بسم الله الرحمن الرحيم

الحمد لله رب العالمين والصلاة والسلام
على المبعوث رحمة للعالمين سيدنا وحبيبنا
محمد وعلى آله الطيبين الطاهرين وصحبه
الغُر الميامين ومن اهتدى بهديهم واستن
بسنتهم إلى يوم الدين

# İçindəkilər

# Müqəddimə

Bu kitabı yazmaq istəyimiz təxminən iki il əvvəl Rusiyada yaşayan soydaşımız Qurban Mirzəxanov ilə aramızda keçən debat ərəfəsində ortaya çıxdı. Kitabımızın ilk formasının şifahi şəklini çox gözəl xatırlayıram. Evimizin balkonunda Kərkükdən türkmən qardaşım Savaş İmamoğlu və azərbaycanlı əziz qardaşım Tehran Abdurrahim ilə çay süfrəsi arxasında etdiyimiz müzakirələrdə kitabımızın ilk arqumentləri səslənirdi. Ona görə də bu kitab üçün hər iki qardaşıma xüsusi təşəkkürlərimi bildirirəm.

Bizimlə eyni vətəni bölüşən şiə həmvətənlərimiz ilə arada sağlam bir dialoqun olmasını nəzərə alaraq elmi bir üslubda, yoxlanılmış məlumatlarla zəngin bir kitabın yazılmasına ehtiyac olduğuna inanıram. Bu barədə yazılmış ədəbiyyat Şərqdə əsasən ərəb və fars dillərində, Qərb dünyasında isə ingilis dilində mövcuddur. Doğma azərbaycan dilində yazılmış materiallarda isə ciddi problemlər var. Üç ilə yaxın bir müddət ərzində yazdığımız bu kitab ilə boşluğu qismən də olsa doldurmağı qarşımıza məqsəd qoymuşduq.

Bu kitab həm də Azərbaycanda dini diskursda gedən istənilən müzakirə üçün gözəl bir nümunə ola bilər. Çünki çox təəssüf ki, dini qrupların üzvləri arasında gedən müzakirələrin səviyyəsi həddindən artıq aşağıdır. Bunun din ilə və ya dini qruplar ilə əslində heç bir əlaqəsi yoxdur. Düşünürəm ki, Azərbaycan cəmiyyətində istənilən mövzuda belə bir böhran özünü hiss etdirir. Bu isə azərbaycanlı gənclərin arasında ümumiyyətlə müzakirə ədəbinin olmamasından qaynaqlanır. Bu vəziyyəti müsbət yöndə dəyişmək üçün müzakirələrin olması zəruridir ki, bu yolda hansısa bir irəliləyiş qeydə alınsın. Müzakirələrdən uzaq durmaq və ya onları qadağan etmək heç zaman qruplar arasındakı gərginliyi və ya aqressivliyi azaltmayacaq, əksinə yalnız sıx müzakirə mühitində müzakirə iştirakçılarının bir-birilərinin fikirləri ilə tanış

olmaq, onları doğru anlamaq imkanı olar və dolayısıyla müzakirənin ədəblərini də öyrənmək yalnız onunla məşğul olmaqla mümkündür.

Bu prinsiplərə inandığımız üçün kitabı yazarkən mümkün olduğu qədər ehtiramlı olmağa çalışmışıq. Lakin bütün bunlara baxmayaraq kitabda oxucunun qarşılaşacağı qıcıqverici və üzücü məqamlar varsa bu ümumiyyətlə mövzunun özünün həssasiyyətindən irəli gəlir. Ona görə də kitabımızı oxuyan şiə qardaş və bacılarımızı anlayışlı olmağa dəvət edirik və kitabda hər hansı bir yerdə dadsız bir şərh və ya qıcıqverici bir cümlə quruluşu ilə rastlaşdıqda bunu hörmətsizlik və ya pisniyyət olaraq qarşılamamaqlarını xahiş edirik. Əksinə o arqumentlərlə yaxından məşğul olmağı və məsələlərə qarşı tərəfin prizmasından baxmağı təklif edirik. Biz çox gözəl anlayırıq ki, kitabımız hər kəsi qane etməyə bilər, amma şiə qardaşımızın kitabımızı oxuduqda ən azından əhlüs-sünnətin imamətə baxışının nədən qaynaqlandığını görə biləcəklərini ümid edirik. Bu isə həddindən artıq önəmli bir nöqtədir, çünki ədavət əksər hallarda tərəflərin bir-birilərini anlamamaqlarından, nəticədə bir-birilərinin mövqelərini ən çirkin şəkildə təqdim etməkdən qaynaqlanır. İnanırıq ki, əhlüs-sünnətin mövqeyini doğru şəkildə anlamaq aradakı gərginliyin boşalmasına gətirib çıxaracaq və sağlam bir müzakirə mühitə töhfə verəcək. Beləki əhlüs-sünnətin imamət inancını rədd etməsi heç bir şəkildə - bəzilərinin təbliğ etmək istədikləri kimi - əhlul-beytə düşmənçilikdən qaynaqlanmır. Bu kitabımız bu nöqtənin üzərinə dəfələrlə vurğu edir və sünnət əhlinin də əslində özlərini əhlul-beyt davamçıları kimi gördüklərini göstərməyə çalışır.

Bir azərbaycanlı kimi Azərbaycanda dini zəmində qarşıdurmanın və məzhəblərarası ədavətin olmasının tamamilə əleyhinəyik. Cəmiyyətimizin yoğun bir şəkildə müxtəlif təsirlərin altında daim dəyişdiyini gördüyümüz üçün bununla bağlı ciddi maarifləndirmə işlərinin aparılması gərəkdiyinə inanırıq. Bu isə mövzu haqqında kifayət qədər dolğun materialların ərsəyə gətirilməsi ilə mümkün ola bilər. Soydaşlarımızın soyuq başla məsələləri təhlil etdiklərini, əsk fikirlərə qarşı dözümlü yanaşdıqlarını görmək istəyirik.

Kitabımızı beş yerə ayırmışıq. İlk hissədə ümumilikdə imamət mövzularına giriş olması üçün mücməl şəkildə məlumat veririk. Burada mövzunun şiə məzhəbindəki əhəmiyyətini və onunla bağlı açar nöqtələri qeyd etmişik. İkinci hissədə imamət bəhsində Quranın yerinə toxunuruq və burada imamətə dair Qurandan gətirilən arqumentlərə nəzər salırıq. Çünki şübhəsiz ki, bir müsəlman şəxsiyyətin

inandıqlarında özünə rəhbət götürdüyü ən əsas qaynaq Allahın Kitabıdır. Kitabımızın üçüncü hissəsində isə Peyğəmbərin – aleyhissalətu vassələm - sünnətdən bununla bağlı gətirilmiş dəlilləri ələ alırıq və bu dəlillər barəsində şiə alimlərinin öz sözlərini, sünnət əhlinin bu dəlillərə yanaşmasını incələyirik. Kitabımızda ən əsas bu müzakirələrə yer vermişik. Dördüncü bölmədə isə şiə məzhəbindəki imamət inancının tarixdən bildiyimiz məlumatlarla nə dərəcədə uzlaşdığını təhlil etmişik. Çünki etiraf etməliyik ki, tarixə baxmadan bu məsələləri doğru dəyərləndirmək mümkün deyildir, beləki imamət haqqındakı günümüzdəki təsəvvürlər tarixi şəxsiyyətlərin həyatı ilə sıx bir şəkildə bağlıdır. Onların tarixdəki əksinə nəzər salmadan onlar haqqında günümüzdə sahib olduğumuz təsəvvürlərin doğru olub olmadığını bilməyimiz mümkün deyildir. Ən sonda isə mövzu ilə bağlı qarşıya qoyulmuş ən əsas əqli və rasional arqumentlərə yer veririk, onları kritik şəkildə təhlil etməyə çalışırıq. Kitabımızda açdığımız mövzularda apardığımız təhlillərdə hamıdan qabaq imami şiələrinin öz alimlərinin sözlərinə önəm vermişik və məsələlərə onların prizmasından baxmağa çalışmışıq. Bunu etməkdə məqsədimiz şiə etiqadlarını bacardığımız qədər dürüst və tam şəkildə oxucuya çatdırmaq olub.

Bu kitabı yazıb başa çatdıra bildiyim üçün bütün şükürlərin və təriflərin ən gözəlinin hər kəsdən əvvəl aləmlərin Rəbbinə aid olduğunu etiraf edirəm. O nə gözəl Mövladır! Bundan sonra bu kitabı yazmağım üçün mənə ehtiyac duyduğum məişət şəraitini sağlayan və mənəvi dəstək verən həyat yoldaşıma şükran borcumu təqdim edirəm. Məni gözəl yarsız buraxmadığı üçün Rəbbimə sonsuz həmd edirəm! Kitabımı yazdığım ərəfədə mənimlə mütəmadi olaraq əlaqədə olan və kitabın içindəki arqumentləri canlı şəkildə bizimlə müzakirə edən şiə və əhlüs-sünnət dostlarıma da xüsusi təşəkkürlərimi bildirirəm. Şübhəsiz ki, mənə tanıdıqları bu müzakirə imkanlarının sayəsində bəzən öz mövqelərimizdəki qüsurları görə bilmişik, bəzən də yazdığımız bəzi məsələlərin ümumiyyətlə kitabımıza münasib olmadığını görə bilmişik, bir çox halda isə çatışmayan müzakirələri tamamlaya bilmişik. Yazı prosesində yaşadığımız ruh düşkünlüyündə məni həvəsləndirən və kitabı tamamlamaq üçün lazım olan mənəvi dəstəyi əsirgəməyən dostlarımızı da unutmamışam. Fərqli sosial şəbəkələrdə mənə müsahib olmuş bu dostlarımızın təqdiri və dəstəyi sayəsində işimizin əziyyətlərinə qatlanmaq daha asan və daha xoş olmuşdur. Onların hamısının adını burada qeyd edə bilmədiyim üçün üzrxahlıq etməliyəm.

Sonunda qeyd etməliyəm ki, kitabımızda doğru olan hər bir şey Allahın lütfü və rəhmətidir. Hər bir xəta isə hər şeydən əvvəl öz nəfsimdəndir.

Samir Təhməzxan
03 May, 2025
Yöterborq şəhəri, İsveç

# İmamət bəhsi

İslam ümmətinin tərkibində səhabələrin zamanından başlayaraq ixtilafların formalaşması, aradakı fərqlərin dərinləşməsi və çoxsaylı firqələrin, camaatların əmələ gəlməsi tarixdən bizə məlum olan məsələlərdəndir.. Bu firqələr arasındakı ixtilaf, mübarizə və münaqişələr şübhəsiz ki, ən ağır fəsadlara, unudulmaz acılara gətirib çıxarıb. İslam tarixini oxuyanlar bu qanlı və kədərli səhifələr ilə tez-tez qarşılaşır.

Bu ixtilafların içərisində yarası ən dərin olan, zərəri ən davamlı olan, münaqişəsi ən uzun olan imamət mövzusudur. Siyasi bir ixtilaf olaraq başlayan bu fikir ayrılığı zamanın axarı ilə böyük təfriqəyə gətirib çıxarıb; bu gün biz bu ayırımı sünni-şiə ayırımı kimi tanıyırıq. Formalaşmış bu parçalanma nəinki daxili müharibələrə, hətta xarici düşmənlərin müdaxiləsinə, işğallarına da gətirib çıxarmışdır. Ona görə də əş-Şəhristani deyir: “Ümmət arasındakı ən böyük ixtilaf imamət ixtilafıdır; çünki İslam dinində imamətə görə bütün zamanlarda çəkilmiş qılınc qədər başqa heç bir dini məsələdə qılınc çəkilməyib…”[1] Şəhristani bununla da demək istəyir ki, ümmətin ixtilaf etdiyi başqa heç bir mövzuya görə bu qədər qan axıdılmayıb. Tarixin səhifələrini vərəqləmiş hər bir kəs onun bu sözlərini təsdiqləməkdə çətinlik çəkməz. Çox təəssüf ki, bu ixtilaf günümüzə qədər öz aktuallığını qoruyub saxlayıb və sünni-şiə parçalanması bu gün də həmçinin fərdlər arasındakı münasibətlərdən başlayaraq dövlətlər arası münasibətlər səviyyəsində öz mənfi təsirini hiss etdirir. İctimai dini müzakirələrdə bu günə qədər davam edən mübahisələrin ciddi bir payı şiə-sünni münaqişələrinə düşür. Beləliklə də şiəlik ilə digər firqələr arasında duran ən əsas məsələ imamət məsələsidir. Şeyx Musa əl-Musəvi[2] “əş-

---

[1] əş-Şəhristani, “əl-Miləl van-Nihəl”, 1/22; Muəssəsə əl-Hələbi

[2] Musa əl-Musəvi (1930-1997) Nəcəf şəhərində doğulub. O, dövrünün ən böyük mərcisi olmuş Əbul-Həsən əl-Musəvi əl-İsfəhani’nin (1861-1946) nəvəsidir. Atasının qətlindən sonra babasının yanında 17 il qalıb. İlk təfsilini Nəcəfin dini hövzəsində alıb və oranı ictihad

Şiə vat-Təshih" kitabının müqəddiməsində yazır: "İmamət, şiə imamiyyə məzhəbinin təməl daşıdır, zeydilərdə də, ismaililərdə də eynilə bu şəkildədir. İslam məzhəbləri arasında mübahisə və müzakirəyə səbəb olan bütün məsələlər də məhz bu mövzudan törəyir."[3] Həqiqətən də ümumilikdə şiəliyi - müxtəlif növləri ilə - digər firqələrdən ayıran əsas amil imamət məsələsidir; şiəliyin ortaya çıxmasının əsas səbəbi də imamət məsələsi olub. Şiələrin ən seçkin xüsusiyyəti imamətə nisbətdir, hətta imaməti ən dar çərçivədə qəbul edənlər özlərini digər şiə qrupları arasında "İmami şiələri" və ya "imamiyyə" adı ilə tanıdırlar. İmamət mövzusu elə bir mərkəzi bir yer tutur ki, hətta deyilib ki, "məsumluq, racə, bədə, təqiyyə kimi şiələrə aid olan digər etiqadi məsələlər də imamət mövzusunun ətrafında dövr edir, beləliklə də bu, etiqadın cövhəridir, məzhəbin əsasıdır."[4]

Təbii ki, Azərbaycan kimi bir cəmiyyətdə fərqli düşüncələri təmsil edən qruplar arasında gedən canlı müzakirələrin bir qismi dini mövzular haqqındadır. Tarixən sünnilərin və şiələrin iç-içə yaşadığı bu coğrafiyada məhz sünni-şiə polemikası qaçınılmaz bir haldır. Bir-çox hallarda xoşagəlməz və dadsız bir forma alan bu müzakirələrin nəticəsi sadəcə aqressiya və nifrət olur. Təəssüf ki, informasiya dövründə yaşamağımıza baxmayaraq əksər hallarda susub kənardan müşahidə edən elm olduğu halda meydan natiqlik edib danışan cəhalət olur. Bu cür mübahisələrin üzücü xüsusiyyətlərindən biri də budur ki, ən çox müzakirə edilən məsələlər tarixi şəxsiyyətlər ətrafında dönüb dolanır; xüsusilə səhabələr, səhabələrin fəzilətləri və eyibləri diskussiyaların əsas mövzusu olur. Müəyyən bir zehniyyəti təmsil edən bəzi qruplarda, səhabələrdən nəql olunmuş xəbərlərin üzərində durmaq, onları tənqid etmək ilə bağlı qeyri-adi bir həvəs vardır. Bu camaatlar ilə müzakirədə bu cür marginal mövzuların üzərində durmaq çox böyük bir xətadır,

---

mərtəbəsi ilə bitirib. 1955-ci ildə Tehran Universitetində İslam hüququnda doktor dərəcəsini alır və daha sonra Parisdə Sorbonne universitetində təhsilini davam edərək 1959-cu ildə orda ikinci doktor dərəcəsini əldə edir. 1960-63-cü illərdə Tehran universitetində İslam iqtisadiyyatı üzrə professor olaraq çalışır və bu zaman İran parlamentində İsfahanı təmsil edən deputat olaraq mandat qazanır. 1968-ci ildə Basra şəhərində Şahın agentləri tərəfindən hazırlanmış sui-qəsd cəhdindən qurtula bilir. Bağdad universitetində 1968-78-ci illər arasında İslam fəlsəfəsi üzrə dərslər verir. 1973-74-cü illərdə Almaniya Demokratik Respublikasının Halle universitetində və Liviyanın Tripoli universitetində ziyarətçi professor olub. 1975-78-ci illərdə Harvard universitetində elmi işçi və 1978-ci ildə California universitetində müəllim olaraq çalışıb. Musa əl-Musəvi kitablarında ümumilikdə şiəliyin ənənəvi təsəvvürünü, xüsusilikdə isə səfəvi təsirlərini tənqid edir.

[3] əl-Musəvi, "əş-Şiə vat-Təshih", səh: 9;

[4] Subhi, "Nəzəriyyətul-İmamə lədəş-Şiətil-İsnə Aşəra", səh: 28;

çünki səhabə statusu ilə bağlı ixtilaflar müstəqil bir məsələ deyildir, lakin imamət mövzusundakı ixtilaflardan ortaya çıxmış və ondan asılı olan bir məsələdir. Mötəzili alimi əl-Qadi Abdulcabbar haqlı olaraq buyurur: "İmamiyyə şiələri tez-tez Osmanın öz qohumlarını vali olaraq təyin etməsi və digər işləri barədə, Talha, əz-Zübeyr və Aişənin Bəsrəyə getməkləri barədə soruşurlar. Bunun səbəbi, onların zəif olmaqları və dəlillərinin olmamağından başqa bir şey deyildir. Çünki Osman öz qohumlarını vali təyin etməsəydi, etdiyi işləri etməmiş olsaydı, özünün, Əbu Bəkr və Ömərin imamlığını iddia etdiyi üçün yenə də imami şiələrin nəzərində kafir və müşrik sayılacaqdı. Talha, əz-Zübeyr və Aişə möminlərin əmiri (Əli)nin ordusunda iştirak edib onunla birlikdə vuruşmuş olsaydılar belə, Əbu Bəkr, Ömər və Osmanın imamətinə etiqad etdikləri üçün onlara yenə müşrik hökmündən başqa bir hökm verməyəcəkdilər. İmami şiələr ilə bu mövzuda danışmaq yəhudilər ilə təharətdə niyyətin vacibliyi barəsində, məsihilər ilə içkinin halallığı barədə danışmaq kimidir…. Bunu bil və bu haqda onlarla (İmamiyyə ilə) danışma! (İmamlıq barəsində) iddia etdikləri naslar haqqında onlarla danışın! Çünki əsas olan budur."[5] əl-Qadi Abdulcəbbar həm sünni, həm də şiə camaatlarını yaxından tanıyan, buveyhilərin hökmranlığı dönəmində onlarla iç-içə yaşamış bir kəsdir. Şiələrdəki etiqadi məsələlərin dayandıqları əsasları araşdırmış hər bir kəs, həmçinin şiə-sünni müzakirələrindən təcrübəsi olan hər bir kəs Abdulcəbbar'ın bu sözlərinin doğruluğunu təsdiqləyə bilər.

---

[5] Abdulcabbar, "Təsbit Dəlail ən-Nubuvvə", 1/294; Darul-Arabiyyə, Beyrut

## İmamət nədir?

Müzakirəmizin başında "imamət" inancının mahiyyəti ilə tanışmağımız lazımdır. Çünki mahiyyətinin nə olduğunu dərk etmədiyimiz bir konseptin üzərində fikir yürütmək əbəs bir şeydir. Bu kitabımızda biz "imamət", "imamlıq", "vilayət"[6] sözlərini işlətdiyimizdə məhz imami şiələrinin öz məzhəblərində nəzərdə tutduqları imamət konseptini qəsd edirik. "Xilafət" sözü isə daha geniş bir mənada işlədilib; çünki bura sünnət əhlinin nəzərində tutduğu dövlət başçılığı modeli də daxilldir.[7] Bu məsələni araşdırmış və mövzu haqqında kitab yazmış müəlliflərə görə sünnət əhlinin bu mövzuda istifadə etdikləri terminologiya şiələrdən təsirlənib, çünki bu mövzuları etiqadı əsaslara daxil edənlər şiə əhli olub. Beləliklə də bunu etiqad çərçivəsində görən şiələrə cavab vermək məqamında duran sünnət əhli öz cavablarında şiələrin istifadə etdikləri terminologiyadan istifadə etməli olublar. Sünnət əhlinin nəzərində bu məqama ən uyğun olan söz "xəlifə" sözü olsa da yenə əqidə və fiqh kitablarında "imamət" sözünü işlədiblər. Bu da şiələrin "xəlifə" sözünü işlətməyib yerinə "İmam" sözünü işlətməklərindən qaynaqlanır.[8] Bu sözlərin doğruluğunu sünnət əhlinin dördüncü xəlifəni "İmam Əli" adlandırması misalı təsdiqləyir, çünki dörd xəlifədən yalnız Əli üçün - radiyallahu anhu - imam sözü işlədilir. Bu isə şübhəsiz ki, şiələrdən təsirlənərək sünnət əhlinin dilinə düşmüş bir sözdür.

Qeyd etməliyik ki, xilafət məqamı, yəni ümmətin üzərində bir xəlifənin olması ümmətin böyük əksəriyyətinə görə vacibdir. Bu

---

[6] Ərəb dilində işlədilən "vilayət" sözü ilə "vəlayət" sözü arasında fərq vardır. Birincisi hakimiyyət, valilik mənasını ifadə edir və vilayətə sahib olana "vali" deyilir. İkincisi isə himayə, dostluq, sevgi, nüsrət mənalarını verən vəlilik məqamını qəsd edir ki, bu məqam sahiblərinə "vəli" və cəm formasında "övliya" deyirlər.

[7] əd-Dəmici'yə görə "imamət" adı daha çox əqidə və fiqh kitablarında işləndiyi halda "xilafət" adı tarix kitablarında daha geniş istifadə olunur. bax: "əl-İmamətul-Uzmə", səh: 36;

[8] Bax: Əhməd Mahmud Subhi, "Nəzəriyyətul-İmamə lədəş-Şiətil-İsnə Aşəra", səh: 23-24; Dər ən-Nəhda əl-Arabiyyə

məsələdə xavariclərə aid olan bəzi camaatlardan başqa və mötəzili məzhəbindən bir iki nəfərdən başqa heç kim ixtilaf etməyib. Bu fikir xavariclərdən nəcdatilərə, mötəzililərdən isə Əbu Bəkr Abdurrahmən bin Keysən əl-Əsam və Hişəm bin Ömər əl-Futi'yə nisbət edilir.[9] Bu vacibiyyətin əqli, yoxsa şəri olmasında da fikir ayrılığına varıblar, şiələrin üsuli qoluna aid olanlar imamətin əqlən Allaha vacib olduğunu deyirlər[10]; bununla bağlı gətirdikləri ən əsas dəlil olan "lütf" nəzəriyyəsinin müzakirəsi ilə qarşıda tanış olacağıq. Bunun əqlən vacib olduğunu, lakin Allaha yox, insanların üzərinə vacib olduğunu deyənlər isə mötəzililərdən əl-Cahiz, Əbul-Qasim əl-Bəlxi və Əbul-Hüseyn əl-Basri'dir. Sünnət əhli isə imamətin vacibliyinin əqlən yox, şərən sabit olduğunu deyir.[11] Lakin qeyd etməliyik ki, ümumi şəkildə xəlifə məqamının bir vacibiyyət, bir zərurət olduğuna etiqad etməklə şiələrdəki imamət məqamının vacibliyinə etiqad etmək eyni şey deyildir. İmam məqamı şiələrdə özünə aid xüsusi bir məzmunda çox əhəmiyyətli bir məqam sayılır. Ona görə də şiə alimlərinin bu məqama verdikləri tərif ilə tanış olmağımız lazımdır.

Şeyx əl-Mufid imam məqamına tərif verərkən deyir: "İmam, peyğəmbərə - aleyhissələm - naib olaraq (niyabətən) din və dünya işlərində ümumi riyasətə sahib olan insandır."[12] əl-Allənə əl-Hilli isə yazır: "İmam, əsalətən bu dünyada dini və dünyəvi işlərdə ümumi riyasətə sahib olan insandır."[13] əl-Bəhrani sadəcə olaraq "din və dünya işlərində insanlardan bir şəxsin ümumi riyasəti" olaraq tərif verir.[14] Mahmud əl-Himsi isə yazır ki, "şəriət örfündə (imamət sözü) mütləq şəkildə gəldikdə, dünyada sağ ikən bir başqasının naibi olmadan, əsalət ilə din işlərində[15] ümumi riyasət qəsd olunur."[16] Burada "əsalət" sözü ilə qəsd edilən budur ki, imam özlüyündə müstəqil bir şəkildə başçı və

---

[9] əd-Dəmici, "əl-İmamətul-Uzmə", səh: 45-46;

[10] Sünnət əhli və mötəzililərin əksəriyyəti bunu şəri yollarla vacib hesab etdikləri halda, imami şiələri, bağdadlı mötəzililər və basralı mötəzililərdən əl-Cahiz bunu əqlə vacib görürdülər. Şiələr ilə mötəzililər arasındakı fərq isə bunda idi ki, şiələr bunu Allah üçün vacib gördükləri halda mötəzililər bunu insanlara vacib görürlər.

[11] ət-Tusi, "Təlxis əl-Muhassal", səh: 458;

[12] əl-Mufid, "ən-Nukət əl-İtiqadiyyə", səh: 39;

[13] əl-Hilli, "əl-Əlfeyn", səh: 22;

[14] əl-Bəhrani, "ən-Nəcətu fil-Qiyəmə fi Təhqiq Əmr əl-İmamə", səh: 29;

[15] Burada yalnız "din işlərini" xüsusiləşdirməsi ilə dünya işlərində riyasətin bura daxil olmadığını qəsd etmir. Əksinə dövlət siyasətini, hakimliyi, ədalət ilə idarəni də dini məsələlər içində görür.

[16] əl-Himsi, "əl-Munqiz minət-Təqlid", 2/236;

rəhbər olmalıdır, başqa bir şəxsin naibi, qazisi, əmiri olanlara imam deyilməz. Bu söz ilə imamın peyğəmbərin - aleyhissələm - naibi olması arasında ziddiyyət yoxdur, çünki buradakı naiblik sözü ilə qəsd olunan "peyğəmbərliyin uzantısı və davamı" mənasıdır. Ona görə də bu ikisi arasında ziddiyyət əmələ gəlməsin deyə əl-Himsi öz tərifində "dünyada sağ ikən" qeydini əlavə edir, çünki imamət məqamı peyğəmbərin ölümündən sonra gələn bir məqamdır. Seyyid Əli əl-Bəhbəhəni yazır: "İmamət, Allahın elçisinin - salləllahu aleyhi va əlihi va səlləm - din və dünyəvi işlərdə xəlifəliyinin və əmr etdiyi, qadağan etdiyi işlərdə ümmətin itaət etməsi fərz olduğu məqamın ifadəsidir."[17] Bu və buna bənzər təriflərə yer verən Cəfər əs-Subhəni axırda yazır ki, "imamət üçün ən doğru tərif onun ümumi ilahi riyasət olmasıdır."[18]

ət-Tabərsi "Məcmə əl-Bəyan" təfsirində yazır: "İmam ləfzindən iki məna anlaşıla bilər. Birinci mənada o, fellərində və sözlərində tabe olunan, izlənilən biridir. İkinci mənada isə o, ümmətin və siyasətinin tədbiri ilə məşğuldur, onun işlərini yerinə yetirən, cinayətkarlarını cəzalandıran, valilərini təyin edən, layiq olanlara hədd cəzalarını tətbiq edən, düşmənlərinə qarşı vuruşandır. Birinci mənada peyğəmbərlərdən hər biri imamdır. İkinci mənada isə hər bir peyğəmbərin imam olması vacib deyildir, çünki cinayətkarları cəzalandırmaqla, düşmənlərə qarşı vuruşmaqla, dinin sərhədlərini qorumaqla, kafirlərə qarşı cihad etməklə vəzifələndirilməmiş olması mümkündür."[19] Beləliklə də başa düşürük ki, birinci mənada imamlıq bütün peyğəmbərlərə aiddir, çünki onlara həyat tərzində, halal və haramlarda tabe olmaq fərzdir. Bununla bağlı Allah - təbərakə va təalə - buyurur: "Biz hər bir peyğəmbəri, - Allahın izni ilə - yalnız özünə itaət olunması üçün göndərdik." [4:64] Lakin ikinci mənaya gəldikdə isə burada müəyyən formada siyasi bir qurumu idarə etməkdən söhbət gedir və bununla bağlı izaha ehtiyac vardır; ət-Tabərsi'nin sözündən belə anlaşılır ki, bir peyğəmbər bu mənada imam ola da bilər, olmaya da bilər və hər iki hal mümkündür. Daha dəqiq deməli olsaq əsl etibarı ilə hər bir peyğəmbər həm dini, həm də dünyəvi məsələlərdə itaət olunması vacib olan bir kimsədir. Yalnız Allahın hikmətinə əsasən Allah bir peyğəmbər olduğu halda onunla yanaşı siyasəti mülkiyyəti başqasına verə bilər. Bunun misalı Quranda adı keçən Talutdur. "Musadan sonra İsrail oğullarından bir dəstəni (onların başına gələnləri) bilmirsənmi? O zaman onlar öz peyğəmbərlərinə

---

[17] əl-Bəhbəhəni, "Misbəhul-Hidəyə fi İsbət əl-Viləyə", səh: 62;

[18] əs-Subhəni, "əl-İləhiyyət alə Hudə əl-Kitəb vas-Sunnəti val-Aql", 4/8;

[19] ət-Tabərsi, "Məcmə əl-Bəyan", 1/276-277;

dedilər: "Bizə bir hökmdar təyin et ki, Allah yolunda vuruşaq!" O dedi: "Sizə vuruşma vacib edilsə, ola bilsin ki, vuruşmayasınız?" Onlar dedilər: "Madam ki, biz yurdumuzdan çıxarılmışıq və övladlarımızdan ayrılmışıq, onda nə üçün Allah yolunda vuruşmayaq?" Vuruşmaq onlara vacib edildikdə isə onlardan az bir qismi istisna olmaqla (hamısı döyüşdən) üz çevirdilər. Allah zalımları tanıyır. Peyğəmbərləri onlara dedi: "Allah Talutu sizə hökmdar təyin etdi!" Onlar dedilər: "O necə bizə hökmdar ola bilər ki, biz hökmdarlığa ondan daha çox layiqik və ona heç böyük var-dövlət də verilməmişdir". O dedi: "Allah sizin üzərinizə onu (hökmdar) seçdi, elm və bədəncə onun gücünü artırdı. Allah Öz mülkünü istədiyi kəsə verir. Allah (hər şeyi) Əhatəedəndir, Biləndir"" [2:246-247]

## İmamət Dinin Üsulundandırmı?

İmamət məsələsi erkən şiə alimlərinin nəzərində bir mənalı olaraq dinin üsulundan sayılırdı və imaməti qəbul etməyənlər heç bir ixtilaf olmadan kafir hesab olunurdu. Bu barədə şiələrin ən böyük alimi Şeyx əl-Mufid yazır: "İmamilər ittifaq ediblər ki, imamlardan hər hansısa birinin imamlığını inkar edən və onlara Allahın vacib etdiyi itaət fərziyyətini rədd edən kafirdir, sapıqdır, atəşdə əbədi qalmağa layiqdir."[20] Şiələrin tanınmış alimlərindən İbn Bəbəveyh əs-Saduq deyir: "Möminlərin əmiri Əlinin və ondan sonrakı imamların imamlığını inkar edən barəsindəki etiqadımız budur ki, o, bütün peyğəmbərlərin peyğəmbərliyini inkar edənlə eyni mərtəbədədir. Möminlərin əmiri (Əli)ni təsdiq edən, lakin ondan sonrakı imamlardan birini inkar edən haqqında etiqadımız isə budur ki, o, bütün peyğəmbərləri təsdiq edib bizim peyğəmbərimiz Muhəmmədin – salləllahu aleyhi va alihi va səlləm – peyğəmbərliyini inkar edənlə eyni mərtəbədədir."[21] Şeyxut-Taifə ləqəbi ilə tanınmış Əbu Cəfər ət-Tusi (385-460) yazır ki, "imaməti inkar etmək küfrdür, necəki peyğəmbərliyi inkar etmək də küfrdür, çünki bu ikisindən cahil olmaq

---

[20] əl-Mufid, "Əvailul-Məqalət", səh: 44;

[21] əs-Saduq, "əl-İtiqadət", səh: 331-332;Muəssəsətul-İməm əl-Hədi

eyni ölçüdədir."[22] Cəmələddin ibn əl-Mutahhər əl-Hilli yazır: "İmamət bizə görə ən əzəmətli ərkanlardan biridir və onsuz iman sabit olmur."[23] Şiələr bu etiqadlarını dəstəkləmək üçün imamlarına bəzi sözlər nisbət edirlər. Misal üçün əl-Kuleyni isnadı ilə rəvayət edir ki, guya Əbu Cəfər əs-Sadiq deyib: "İslam beş şey üzərinə bina edilib: namaz, zəkat, həcc, oruc və vilayət; heç bir şey vilayətə çağırıldığı kimi çağırılmayıb. İnsanlar isə dördünü götürdülər və bunu tərk etdilər."[24] Bir məsələnin üsulud-dindən və ya üsulul-məzhəbdən hesab edilməsi həmin məsələnin küfr və imanla əlaqəli olması deməkdir. əl-Məclisi ona görə buyurur: "Əgər onlar həm dünyada, həm də Axirətdə müsəlman hökmündədirlərsə o zaman onlarla şiələrin fasiqləri arasındakı fərq nədir?! O zaman imamlığın dinin furu məsələlərindən olduğunu deyən müxaliflərə rədd olaraq onun üsulud-din'dən olduğunu deyən haqq tayfanın bu məsələdə icma etməsinin nə faydası qalır?!"[25] Həqiqətən də imamət məsələsində müxalif olmaq insanın Axirətdə qurtulmasına mane olmayacaqsa onu tövhid və risalət əsasları kimi bir əsas hesab etməyin nə mənası var?!

Burada etiraz edib deyə bilərlər ki, əksər şiə alimlərinə görə sünnət əhli müsəlman sayılırlar. O zaman necə olur ki, bu qədər imami şiəsi sünnət əhlinin kafir olduğuna hökm verir. Şiələrdə əş-Şəhid əs-Səni ləqəbi ilə tanınan Zeynuddin əl-Amili (911-965) "Həqaiqul-İmən" kitabında bu problemi müzakirə edir və qeyd edir ki, şiə alimləri, iki şəhadət kəliməsi ilə kifayətlənənlərə müsəlman hökmü veriblər, lakin eyni zamanda küfrün tərifində onu imanın yoxluğu kimi müəyyən ediblər. "Həmçinin daha əvvəl təqdim etdiklərimizdən bildin ki, imami tayfasına görə imamların imamlığını təsdiqləmək imanın üsulundandır, necəki bu, onların məzhəblərində zəruri olaraq bilinən bir şeydir və bunu daha əvvəl onlardan əl-Muhəqqiq (Nəsiruddin) ət-Tusi aşkar sözlərlə nəql etdi. Heç şübhə yoxdur ki, tərkib hissəsi olan əslin yox olması ilə bir şey tamamilə yox olur; beləliklə də iki şəhadəti təsdiq etmiş olsa da sözü gedən təsdiqi həyata keçirməyənin küfrünə hökm etmək lazımdır və bu, həm də on iki imamın imamlığını təsdiqləməyən kəsə müsəlman hökmü verməklə də uyğun gəlmir…" əş-Şəhid əs-Səni'nin burada qeyd etdikləri problemi oxucuya çatdırmaq məqsədini

---

[22] ət-Tusi, "Təlxisuş-Şəfi", 4/131;

[23] əl-Hilli, "əl-Əlfeyn fi İməməti Əmir əl-Muminin Əli bin Əbi Talib", səh: 46;

[24] əl-Kuleyni, "əl-Kəfi", 2/18; əl-Məclisi "Mirətul-Uqul" kitabında (7/101) isnadına "muvassəq kəs-sahih" hökmü verir.

[25] əl-Məclisi, "Bihərul-Ənvar", 8/368;

daşıyır. Yəni əgər imamət dinin əsllərindən bir əsldirsə və əsl yox olduqda din özü də yox olmalıdırsa o zaman imaməti qəbul etməyənlərə müsəlman hökmü vermək necə mümkün ola bilər? əş-Şəhid əs-Səni bu problemin həllini belə izah edir: “Bunun cavabı budur ki, iki hökm arasında uyğunsuzluq yoxdur, beləki sözü gedən təsdiqi olmayan kəsin həqiqətdə kafir olduğuna hökm edirik və onun müsəlman olduğuna hökm etmək sadəcə zahirdədir, beləliklə də iki hökmün yeri fərqlidir, ona görə də uyğunsuzluq yoxdur."[26] əl-Amili daha sonra sözünün davamında buyurur ki, imami şiələri sünnət əhlinin zahirən müsəlman olub olmamasında ixtilaf ediblər; bir qrup onların zahirən də kafir olduqlarını desə də, əksəriyyət zahirən müsəlman hökmü veriblər və daha sonra əlavə edir: “Aşkar olan budur ki, bu ixtilaf ləfzidir, çünki onların müsəlman olduqlarını deyənlər bununla, İslam hökmlərinin çoxunun onlar üçün keçərli olmağını qəsd edirlər, bununla heç də onların həqiqətdə müsəlman olduqlarını qəsd etmirlər, çünki eyni zamanda onların cəhənnəmə girəcəklərinə dair icma nəql edirlər…”[27] Bu icmanı əl-Murtəda “ər-Risələ əl-Bəhira fi Fədl əl-İtratit-Tahira” adlı risaləsində belə təsdiq edir: “Onları (yəni imamları) bilmək Allahu təaləni bilməkdə olduğu kimi iman və islamdır və onlardan cahil olmaq, onlarda şəkk etmək Allah haqqında cahil olmaq, Allaha şəkk etməkdə olduğu kimi küfrdür və imandan çıxmaqdır. Bu məqam peyğəmbərimizdən - salləllahu aleyhi va alihi - və ondan sonra möminlərin əmirindən, onun kökündən olan imamlardan - hamısına salam olsun! - başqa bəşəriyyətdən heç kəsə aid deyildir… Bizim zikr etdiklərimizin - onlara salam olsun! - imamlığını bilməyin imandan olmasına, bunda xələlin küfr və imandan dönmək olmasına dəlalət edən dəlil budur ki, imami şiələr bunda icma ediblər, beləki onlar bunda ixtilaf etmirlər…”[28] Buradan anlaşılır ki, əksər imami şiələri sünnət əhlini zahirən müsəlman hesab etsələr də, onları batinən kafir hesab etməkdə ixtilaf etməyiblər və icma ilə onların cəhənnəmlik olduqlarına hökm edirlər. Hətta bəzi alimləri qeyd edirlər ki, imamların inkarı peyğəmbərlərin inkarından daha ağır, daha pisdir. İbnul-Mutahhar əl-Hilli yazır: “İmamət ümumi lütfdür, nübuvvət isə xüsusi lütfdür, çünki hansısa zaman kəsimi diri bir peyğəmbərdən xali ola bilər, imam isə

---

[26] əş-Şəhid əs-Səni, “Həqaiqul-İmən”, səh: 131-132;

[27] Eyni mənbə, səh: 133;

[28] əl-Murtəda, “ər-Rasəil val-Məsəil”, 3/219-220; Muəssəsətut-Tabi van-Nəşr, Məşhəd, 1442

belə deyildir… Ümumi lütfü inkar etmək xüsusi lütfü inkar etməkdən daha şərlidir.”[29]

Bəzi müasir şiələr iddia edirlər ki, imamət məsələsi müasir üsuli alimlərin çoxuna görə dinin əsaslarından yox, məzhəbin əsaslarından sayılır. Bununla əldə etməyə çalışdıqları təsəvvür isə budur ki, guya məzhəbin üsulundan olan şeylərə görə təkfir edilmir. Misal üçün müasir şiə alimlərindən Muhəmməd Asif əl-Muhsini yazır: “Sonra bil ki, imami şiələrinə görə imamət məsələsi furudan yox, üsuldan olsa da, lakin üsulul-məzhəbdən sayılır, üsulud-dindən deyildir; onu inkar edən İslam dinindən çıxmaz… ancaq şiə məzhəbindən çıxar, beləliklə də (imaməti) inkar edən müsəlmandır, mömin deyildir…”[30] Beləliklə də bu kimi sitatlardan elə nəticə çıxarmaq olar ki, “imamət” dinin üsulu olmadığı üçün yuxarıda dediklərimiz keçərli olmaz. Lakin bu, həqiqəti haqqı ilə təmsil etmir, doğru olanı tam çılpaqlığı ilə ortaya qoymur. Doğru olan budur ki, imamətə “üsulud-din” yerinə “üsulul-məzhəb” demək digər firqələrə zahirən müsəlman hökmü vermək üçün ortaya atılmış bir incəlikdir, amma on iki imam şiəsi olmayan hər kəs - imami şiələrinə görə - batində kafir hesab olunur. Gəlin müasir üsulu məktəbinin ən bariz üzvlərindən biri olan Əbul-Qasim əl-Xoyi’nin sözləri ilə tanış olaq. O, ümumiyyətlə on iki imam şiələrinə müxalif olan firqələrin, xüsusilikdə isə sünnət əhlinin hökmündən danışarkən “xəlifəlik mənasındakı vilayətin dinin zərurətlərindən yox, məzhəbin zərurətlərindən” olduğunu qeyd etdikdən sonra mövzunun axırında yekun rəyi belə ifadə edir: “Doğru olan budur ki, on iki imam şiələrinə müxalif olmuş bütün firqələrin təmizliyinə və zahirən müsəlman olmaqlarına hökm olunar və burada sünnət əhli ilə digərləri arasında fərq qoyulmaz. Bununla belə onların hamısı həqiqətdə kafirdirlər və onlar bizim, dünya müsəlmanı, axirət kafiri adlandırdıqlarımızdandırlar.”[31] Gördüyümüz kimi əl-Xoyi imaməti üsulud-dindən deyil, üsulul-məzhəbdən saymasına baxmayaraq yenə də müxaliflərin həqiqətdə kafir olduqlarını deyir. Dinin üsulu ilə məzhəbin üsulu arasındakı fərqi şiə alimi Şihəbuddin əl-Məraşi ən-Nəcəfi belə izah edir: “İslam dininin əsasları iki qisimdir; Ondan bir qismi o əsaslardır ki, fiqhi məsələlərdə (kiməsə) müsəlman hökmü vermək ondan asılıdır

---

[29] əl-Hilli, “əl-Əlfeyn fi İmaməti Əmir əl-Muminin”, səh: 23; Darut-Təarif, Beyrut, 2010

[30] Muhsini, “Siratul-Haqq fi əl-Məarif əl-İsləmiyyə val-Usulil-İtiqadiyyə”, 3/174; Zəvil-Qurba, 1428

[31] əl-Xoyi, “ət-Tənqih fi Şərh əl-Urvatil-Vusqa”, 3/80; Muəssəsətu əl-Xoyi əl-İsləmiyyə, 1430;

və bura tövhid şəhadəti və risalət şəhadəti aiddir. Digər qismə gəldikdə isə, bundan yalnız axirətdə qurtuluş, Allahın əzabından xilas olmaq, Onun razılığını qazanmaq və cənnətə daxil olmaq asılıdır; beləliklə də bu qismi etiraf etməyənlərə Cənnətə daxil olmaq haramdır və kafirlər zümrəsinin içərisində atəşə atılacaqlar...Bu ikinci qismə imamət etiqadı, imamı etiraf etmək aiddir."[32]

Bu məsələ şiə alimləri arasında o qədər məşhur və sabit bir məsələdir ki, hansı məktəbə aid olmasından asılı olmayaraq imami şiələrin alimləri bunu kitablarında təsdiq edirlər. Yuxarıda şiələrin fəqihlərindən, üsulilərindən misal verdik. Şiə tayfasına aid olan filosoflar da bu nöqtədə fərqlənmirlər. Misal üçün Muinuddin əş-Şirazi (vəfatı h. 1081) yazır: "Əgər soruşsan ki, buna binaən xilaf əhlinin kafir olması gərəkdir, halbuki alimlərimizin əksərinə görə onlar, müsəlmanlar zümrəsindəndir. Cavabımız budur ki, onların digər kafirlər kimi cəhənnəmdə əbədi qalmaqları mənasında kafir olmaqlarında alimlərimiz ixtilaf etmirlər. Başqa necə ola bilər?! Qurtulmuş haqq firqəsinin ittifaqına əsasən imamət dinin üsulundandır və dinin əsaslarından bir əsası inkar edən kafir olur. İxtilaf sadəcə olaraq onlara kafir hökmünün bu dünyada tətbiq olunması ilə bağlıdır; əshabımızdan əl-Murtəda kimi bəziləri bu rəydədir, əksəriyyət isə digər rəydədir."[33] əl-Məclisi də təsdiq edir ki, "möminlərin əmirinin və onun nəslindən olan digər imamların - aleyhimussələm - imamlığına etiqad etməyənlər və başqalarını onlardan üstün tutanlar barəsində küfr və şirk sözlərinin işlədilməsi onların əbədi cəhənnəmlik olmaqlarına dəlalət edir."[34] Şiə alimləri səhabələri təkfir edərkən, onlara əbədi cəhənnəmlik hökmü verərkən də ən əsas səbəb olaraq Əlinin imamlığını inkar etməklərini göstərirlər. Şeyx əl-Mufid ilk üç xəlifənin "zalım asilər" olduğunu dedikdən sonra heç bir tərəddüd etmədən onların "zülmlərinə görə cəhənnəmdə əbədi qalacaqlar"ını yazır. Həmçinin "möminlərin əmirinə qarşı vuruşmuş Basra və Şam əhlinin hamısı kafirdir, sapıqdır, məlundur və onlar buna görə atəşdə əbədi qalacaqlar."[35] Bu, Əliyə qarşı çıxmağı Allaha və elçisinə qarşı çıxmaqla eyniləşdirməkdir. Burada əl-Qadi Abdulcabbar'ın sözlərini bir daha xatırlamalıyıq ki, imami şiələri ilə digər firqələr arasındakı ayırışma nöqtəsi məhz imamət məsələləridir. Digər məsələlər ixtilafların

---

[32] ət-Tustəri, "İhqaq əl-Haqq va İzhəq əl-Batil", 2/294-295;

[33] əş-Şirazi, "əl-Kəşf əl-Vafi fi Şərh Usul əl-Kəfi", səh: 242-243; Darul-Hədis, Qum, 1429;

[34] əl-Məclisi, "Bihər əl-Ənvar", 23/90;

[35] əl-Mufid, "Əvailul-Məqalət", səh: 42

periferiyasına düşür və ciddi bir əhəmiyyət kəsb etmir, əksinə bu məsələdə tutulan mövqe digər məsələlərə baxış açısına da təsir edir. Çünki digər firqələr ittifaq edirlər ki, etiqad baxımından bir müsəlmanın qurtuluşu üçün tələb olunan iki etiqad vardır; tövhid və nübuvvət. İmami şiələri bu cəhətdən digər firqələrdən seçilirlər. Nəsiruddin ət-Tusi yazır: "İmamilər digərlərindən onunla fərqlənirlər ki, onlara görə cənnətə daxil olmaq və qurtuluş yalnız Muhəmmədin ailəsinin - aleyhimussələm - vəlayətini qəbul etməkdən və onların imam olduqlarına etiqad etdikdən sonra mümkündür. Digər islami firqələrə gəldikdə isə onlar ittifaq ediblər ki, qurtuluşun əsli iki şəhadət kəliməsini iqrar etməkdir."[36]

Ona görə də əl-Mufid kimi bir şiə aliminin bu sözləri qəribə səslənməməlidir: "Vilayət məsələsində haqqa müxalif olanı(n ölüsünü) yumaq və ona cənazə qılmaq iman əhlindən heç kimsə üçün icazəli deyildir. Yalnız zərurət tələb etdikdə bunu təqiyyə baxımından etməsi istisnadır; o zaman xilaf əhlinin yuduğu kimi yumalıdır… ona cənazə qılmalı olsa namazında onu lənətləməli və onun üçün dua etməməlidir."[37] əl-Muhəqqiq əl-Bəhrani yazır ki, Şeyx ət-Taifə ət-Tusi'nin "ət-Təhzib" kitabında yazdıqlarının zahirindən anlaşılan budur ki, şeyxi əl-Mufid ilə bu məsələdə razılaşır. əl-Bəhrani əlavə edir ki, bu həmçinin Əbus-Saləh əl-Hələbi, Səllər əd-Deyləmi, İbn İdris əl-Hilli'nin məzhəbidir və özü də bu məzhəbi "aşkar olan haqq" hesab edir.[38] Əbus-Saləh əl-Hələbi'nin öyrətdikləri xüsusilə maraqlıdır, beləki yazır: "(Ölü) əgər cəbr və ya təşbih və ya etizal və ya xaricilik və ya imaməti inkar etmək baxımından haqqa müxalif biridirsə dördüncü rükətdən sonra onu lənətləyər və cənazədən çıxar. Halı belə olan birinə təqiyyə halı istisna olmaqla heç cür cənazə namazı qılmaq olmaz."[39] Muhəmməd Baqir əl-Bəhbəhəni isə imamət məsələsinin dinin üsulundan olduğunu əsas gətirərək müxaliflərə sədəqə vermək, su vermək kimi bəsit insani əməllərin qadağan olduğunu yazır, bu barədə imamlardan xəbərlərin gəldiyinə diqqət çəkir.[40] Cənazə məsələsi imami məzhəbində çox maraqlıdır, çünki imami şiələri mömin hesab etdikləri şəxslər üzərində cənazə namazı qıldıqlarında bunu beş rükət edirlər. Bir rəvayətdə gəlir ki, Əbu Bəsir deyir: "Mən Əbu Abdullahdan -

---

[36] Nimətullah əl-Cəzairi, "Nurul-Bərahin", 1/64;;

[37] əl-Mufid, "əl-Muqnia", səh: 85;

[38] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira", 10/360;

[39] əl-Hələbi, "əl-Kafi fil-Fiqh", səh: 157;

[40] əl-Bəhbəhəni, "Misbəhuz-Zaləm", 10/473;

aleyhissələm - soruşdum: “Niyə biz cənazə namazında beş dəfə *təkbir* deyirik, halbuki müxaliflərimiz dörd təkbirlə kifayətlənirlər?” O cavab verdi: “Çünki İslamın əsaslandığı sütunlar beşdir: namaz, zəkat, oruc, həcc və biz Əhli-Beytə olan vəlayət. Allah hər bir sütun üçün ölünün üzərində bir *təkbiri* təyin etdi. Siz bu beş sütunun hamısını qəbul etmisiniz, amma müxaliflərimiz dördünü qəbul edib birini inkar etmişlər. Ona görə də onlar ölülərinə dörd təkbirlə, siz isə beş təkbirlə namaz qılırsınız.”[41] Bir başqa rəvayətdə İmam Rza’dan soruşuldu: "Ölünün üzərində beş təkbirin səbəbi nədir?" O cavab verdi: "Rəvayət edirlər ki, bu, beş günlük namazdan götürülmüşdür." Sonra əlavə etdi: "Bu, hədisin zahiri mənasıdır, amma başqa bir izah var. Allah qullarına beş vacib əməl təyin etmişdir: namaz, zəkat, oruc, həcc və vilayət. Ölünün üzərində hər bir vacib əməl üçün bir təkbir təyin edildi. Vilayəti qəbul edənlər beş təkbir deyir, qəbul etməyənlər isə dörd təkbir deyir. Buna görə də siz beş təkbir deyirsiniz, sizə müxalif olanlar isə dörd təkbir deyirlər."[42] Bu rəvayətlər şiələr ilə sünnət əhlinin arasında cənazə namazındakı fərqləri göstərir. İmami şiələri onlara müxalif olan müsəlmanlar üzərində neçə rükət cənazə namazı qılmaq barədə ixtilaf ediblər, ixtilafın səbəbi isə İmam ər-Rida’ya nisbət edilmiş bir xəbərdir ki, orada - iddiaya görə - İmam ər-Rida deyib: “Möminə gəldikdə onun üçün beş təkbir, münafiqə gəldikdə isə dörd təkbir gətirilər, orada salam verilməz.”[43] Əbul-Qasim əl-Xoyi qeyd edir ki, əl-Muhəqqiq əl-Hilli müxalifin cənazəsinin dörd təkbir olaraq qılınmasının vacib olduğunu deyib. əl-Xoyi özü digər rəyi üstün saysa da əl-Hilli’nin rəyi haqqında buyurur: “Ola bilsin ki, ondan sonrakı alimlər arasında məşhur olan bu rəydir.” Heç kim elə düşünməsin ki, əl-Xoyi və digər şiələr müxaliflərin də cənazə namazını qılmağa icazə verməklə onların qurtulacaqlarına ümid edirlər. əl-Xoyi müxalif üçün qılınan cənazə namazının rükətləri barədə danışdıqdan sonra deyir: “Dua etməyə gəldikdə isə ikisi arasında fərq vardır; beləki müxalifin ölüsünə bəd-dua edilməli, mömin üçün isə xeyir-dua edilməlidir. Çünki müxalif - daha əvvəl hökmünü zikr etdiyimiz mustazaflar müstəsnadır - ya inadkardır, ya da müqəssir cahildir. Hər iki halda Allahın düşmənidir.”[44] Belə görünür ki, bu məsələdə şiə alimləri arasında ittifaq var. Əbul-Məcd əl-Hələbi yazır ki, “dördüncü təkbirdən sonra ölüyə haqq əhlidirsə rəhmət

---

[41] əl-Amili, “Vasəil əş-Şiə”, 3/77;

[42] əl-Amili, “Vasəil əş-Şiə”, 3/76; əs-Saduq, “Uyun Əxbər ər-Rida”, 2/82

[43] ət-Tusi, “Təhzib əl-Əhkəm”, 3/193;

[44] əl-Xoyi, “ət-Tənqih fi Şərh əl-Urvatil-Vusqa”, 9/243-245;

diləyər, batil əhlidirsə bəddua edər."[45] Yəhya bin Said əl-Hilli yazır ki, "əgər batil əhlidirsə dördüncü təkbirdən sonra ona bəddua edər, onu lənətləyər və namazdan ayrılar."[46] Hətta şiə kitablarında verilən təfsilatlı məlumatlara əsasən əhlüs-sünnətdən olanların cənazə namazında hansı duaların edilməsi öyrədilir. əl-Feyd əl-Kəşəni yazır: "Müxalifə gəldikdə isə onun üçün qılınan cənazə namazı **dörd təkbirdən** ibarətdir… Səhih rəvayətlərdə deyilir ki, bir mömin üçün beş təkbir deyilir, münafiq üçün isə dörd təkbir edilir. Həsən xəbərə əsasən ona bəd-dua edilər; Əgər ölmüş kəs həqiqəti inkar edən biridirsə (duanda) belə de: "*Allahım, onun içini atəşlə doldur.*""[47] Əli bin Bəbəveyh əl-Qummi yazır: "Ölü əgər müxalifdirsə, dördüncü təkbirində belə de: "Allahım, bu bəndəni və bəndə oğlunu rüsvat et! Allahı, onu atəşə at! Allahım, verəcəyin cəzanın ən ağrılısını, üqubətinin ən şiddətlisini ona daddır! Onu atəşə sal və içini atəşlə doldur! Qəbrini onun üçün dar et, çünki o, Sənin dostlarına düşmənlik etdi və düşmənlərinə dost oldu. Allahım onun əzabını yüngülləşdirmə, əzabını onun üstünə yağdır!" Cənazəsini qaldırdıqda isə desin: "Allahım, onu qaldırma və təmizləmə!"[48] Məsələ o həddə çətib ki, Muhəmməd Həsən ən-Nəcəfi yazır: "Əksinə, ola bilsin ki, onların açıq şəkildə, insanların gözü qarşısında təhqir edilməsi, *təqiyyə* ilə qadağan edilmədiyi müddətcə, ən üstün ibadətlərdən biridir. Bundan da üstün isə, onların qeybətini etməkdir. Bu, bütün dövrlərdə və bölgələrdə şiələrin alimləri və sadə insanları arasında qəbul edilmiş bir təcrübə olmuşdur və elə bir həddə çatmışdır ki, bu mövzuda kitablar doldurulmuşdur. Həqiqətən, onların qeybəti şiələr arasında ən üstün ibadətlərdən və Allaha yaxınlaşmağın ən kamil yollarından biri hesab edilir."[49] Davamında buyurur: "Rəvayətlərin təvatürü və ayələrin çoxluğu onların düşmən bilinməsini və onlardan uzaq durmağı vacib etdiyi halda mömin (yəni şiə) ilə müxalif arasında qardaşlığın ola biləcəyini necə təsəvvür etmək olar!? O zaman, (rəvayətlərdə keçən) "*insanlar*" və "*müsəlman*" ifadələri ilə "*mömin*" mənası başa düşülməlidir, necə ki, dörd rəvayətdə bu şəkildə ifadə olunmuşdur. (əl-Muqaddəs əl-Ərdəbilinin qeybəti ümumən qadağan etməsi) fikri onları öldürməyi, kafirlərə qarşı edilənlərin onlara qarşı edilməsini icazəli

---

[45] əl-Hələbi, "İşəratus-Səbq", 1/104;
[46] əl-Hilli, "əl-Cəmi liş-Şərai", səh: 121;
[47] əl-Kəşəni, "Məfətih əş-Şərai", 2/168;
[48] İbn Bəbəveyh, "Fiqh ər-Rida", səh: 178;
[49] ən-Nəcəfi, "Cəvahirul-Kələm", 22/62;

görən - ki, bu mövqeyin nəticəsində onlar tərəfindən Bağdadda və ətrafında öldürülənlər öldürüldü - Xacə Nəsiruddin ət-Tusi, Alləmə əl-Hillinin və digər alimlərin fikirlərindən nə qədər də uzaqdır!”[50]

## İmamın kimliyi necə bilinir?

Bura qədər təqdim etdiklərimizdən anlaşıldı ki, imami məzhəbinə görə imamət məsələsi dinin üsulundandır və bir kimsənin cəhənnəm atəşindən qurtulmaq üçün tələb olunan şərtlərdəndir. Ona görə də təbii olaraq hər bir kəsə zamanın imanını tanımaq vacib olmalıdır. Bu vacibiyyət sadəcə olaraq kollektiv bir vaciblik deyildir, fərdi vaciblikdir. İbn Həmzə ət-Tusi yazır: “Məhəmməd ibn Əl-Alə Əl-Curcani dedi: "Həcc ziyarətini yerinə yetirdim və Əli ibn Musa Ər-Rzanı - aleyhissələm - Kəbəni təvaf edərkən gördüm. Ona dedim: 'Sənə fəda olum, Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - belə bir hədis rəvayət edilib: *“Kim öz zamanının İmamını tanımadan ölsə, cahiliyyə ölümüylə ölmüşdür.*"' O dedi: 'Bəli, atam mənə babamdan, o da Hüseyn ibn Əli ibn Əbi Talibdən - aleyhimussələm - rəvayət etdi ki, Allahın Rəsulu - salləllahu aleyhi va əlihi - buyurdu: "*Kim öz zamanının İmamını tanımadan ölsə, cahiliyyə ölümüylə ölmüşdür.*"' Ona soruşdum: “Sənə fəda olum, bəs cahiliyyə ölümü ilə ölən nədir?” O dedi: “Bir müşrik.”[51] əl-Kuleyni isnadı ilə rəvayət edir ki, əl-Haris bin əl-Muğira dedi: “Mən Əbu Abdullaha - aleyhissələm - soruşdum: "Allahın Rəsulu - salləllahu aleyhi va əlihi - *“Kim öz İmamını tanımadan ölsə, cahiliyyə ölümüylə ölmüşdür.”* deyib. " O cavab verdi: "Bəli." Mən soruşdum: "Bu, həqiqi cahillərin cahiliyyəsidir, yoxsa sadəcə imamını tanımamaqdan irəli gələn bir cahillikdir?" O dedi: "Bu, küfr, nifaq və azğınlıqdan qaynaqlanan bir cahillikdir."[52] Bu hədis məhz bu ləfzlə və bu məna ilə imami şiələri nəzdində məşhurdur. Ona görə də İbnul-Mutahhar əl-Hilli

---

[50] Eyni mənbə, 22/62-63;

[51] ət-Tusi, “əs-Səqib fil-Mənəqib”, səh: 495;

[52] əl-Kuleyni, “əl-Kəfi”, 1/377; əl-Məclisi “Mirətul-Uqul” kitabında (4/220) isnadının səhih olduğunu deyir.

"Minhəcul-Kəramə" kitabına giriş edərkən imamətin vacibliyini göstərmək üçün bu hədisi dəlil gətirir və deyir: "Allahın elçisi - salləllahu aleyhi va əlihi va səlləm - buyurmuşdur: "Hər kim zamanının imamını tanımadan ölərsə cahiliyyə ölümü ilə ölmüşdür."[53] Əhlüs-sünnət qaynaqlarında bu ləfzdə və bu mənada heç bir hədis mövcud deyildir.[54] İstənilən halda ortaya çıxan nəticə budur ki, imami şiələrinin qəbul etdikləri mövqenin tələbi ilə hər zamanın imamını şəxsən tanımaq, onun şəxsən kim olduğunu, adını və atasının adını, vəsflərini bilmək zərurətdir və fərdi vacibiyyətdir, beləki bir fərd bu vəzifəni yerinə yetirmədiyi təqdirdə imanı səhih olmaz.

Belə bir ağır və təhlükəli məsələ bizi bir sual ilə üzləşdirir; əgər imamları tanımaq və onlara iman gətirmək bu qədər ciddi bir vacib işlərdəndirsə o zaman imamları tanımağın yolları necə olmalıdır? Misal üçün imamları bizə tanıdan xəbərlərin gizli olması mümkündürmü? Yoxsa onların imamlığına dəlalət edəcək xəbərlər və dəlillər qəti və güzəştsiz olmalıdır? Çünki belə təhlükəli bir məsələdə imamların kimliyinə dəlalət edəcək dəlillərin gizli olması əqlən çirkin qarşılanır. Axı insanın imanını səhih edəcək və Axirətdə onun qurtuluşuna qarantiyaya alacaq səbəblər gizli qalmamalıdır. İmami şiələrin böyük alimləri bu sualın arxasında duran məntiqi anladıqları üçün buna bir mənalı cavab veriblər və deyiblər ki, imamları tanıdan xəbərlər "nass" olmalıdır. Bilmək lazımdır ki, "nass" ilə, tələb olunan mənaya dəlaləti qəti, aşkar və birmənalı xəbər qəsd olunur. Muhəmməd Bəqir əs-Sadr bunu belə izah edir ki, "nass" adlandırdığımız "ləfz(lər)in dəlildə dil baxımından yalnız bir mənası olur və dil nizamında, ümumi örfdə başqa mənaya dəlalət etmək üçün yaramır." Bu cür xəbərləri, "mənasında

[53] əl-Hilli, "Minhəcul-Kəramə fi Mərifətil-İmamə", səh: 27;

[54] Sünnət əhlində bu ləfzə ən yaxın olan hədisi ət-Tayəlisi "əl-Müsnəd" kitabında (2025) və İmam Əhməd "əl-Müsnəd" kitabında (28/88; ər-Risələ) rəvayət edir və ləfzi belədir: "Hər kim imamsız ölərsə cahiliyyə ölümü ilə ölmüşdür." ət-Tayəlisinin rəvayətində əlavə olaraq bu ləfz keçməkdədir: "Kim itaət əhdini pozarsa Qiyamət günü heç bir üzrü olmadan gələcək." ət-Tayəlisi'nin rəvayəti İbn Ömər'dən gəlir və isnadında Xaricə bin Musab olduğu üçün zəifdir. (Bax: əl-Busiri, "İthəful-Xiratil-Məhərə", 5/59) İmam Əhmədin hədisini isə Müaviyə rəvayət edir və Şeyx Şueyb isnadının həsən olduğunu yazır. Mənasına gəldikdə isə İmam Əhməd'in özündən bu hədisin mənası barədə soruşurlar və deyir: "İmamın kim olduğunu bilirsiz? İmam o kəsdir ki, müsəlmanlar onun barəsində icma edirlər, hamısı "bu bir imamdır" deyir." (bax: İbn Teymiyyə, "Minhəc əs-Sunnə", 1/529) Beləliklə də sünnət əhlinə görə burada qəsd olunan ümmətin üzərində icma etdiyi bir imama qarşı gəlmək, ona itaətsizlik etmək barəsindədir. Üstəlik sünnət əhli buradakı "cahiliyyə ölümünü" küfr mənasında başa düşməyiblər.

aşkar" və "nass" adlandırır.[55] Bəzən də bunu ifadə edərkən "ən-nass əl-cəli" sözünü işlədirlər, yəni dəlaləti aşkar olan nassı qəsd edirlər. Bununla da zeydi şiələrinə müxalif olduqlarını göstərirlər, çünki zeydi şiələrinə görə imamın kim olduğunu bilmək üçün "ən-nass əl-xafiy", yəni "gizli nass" kifayət edir. Onlar inanırlar ki, peyğəmbərimiz - aleyhissalətu vassələm - Əli bin Əbi Talibi aşkar nass ilə yox, gizli nass ilə təyin etmişdir. Zeydi şiələri imamın şəxsini tanımadığı imamın səhihliyi üçün şərt görmədikləri üçün gizli nassın ola biləcəyini problemsiz qarşılayırlar. Amma imamın şəxsini tanımağı imanın keçərliliyi üçün şərt hesab edən imami şiələri bu nöqtədə nassın gizli ola biləcəyini inkar edirlər və etməlidirlər.

əş-Şeyx əl-Mufid imami şiələrin tərifini verərkən qeyd edir ki, "imami" adı "imamətin vacibliyinə, onun bütün zamanlarda mövcud olduğuna inanan, hər bir imam üçün cəli nassın, məsumluğun və kamilliyin olmasını vacib görən və sonra imamlığı əl-Hüseyn bin Əli'nin övladlarında məhsur qılan" kəslərə verilir.[56] Beləliklə də burada xüsusilə "cəli", yəni aşkar nass deməklə zeydi şiələrlə aradakı fərqə işarət etmişdir. Həmçinin Nəsiruddin ət-Tusi yazır: "İmamın Allah – təalə - tərəfindən və ya Allah tərəfindən təyin olunmuş bir kəs tərəfindən nass ilə olmasında ittifaq etdikdən sonra onu bilməyin yolu haqqında ixtilaf etdilər: On iki imam şiələri və keysanilər dedilər ki, bu, yalnız cəli olan nass ilə hasil olur, başqası ilə olmaz. Zeydilər isə dedilər ki, gizli nass ilə də olar."[57] Beləliklə də buradan anlaşılır ki, zeydi şiələri imamları tanıtmaq barəsində gəlmiş xəbərlərdə gizliliyin ola biləcəyini qəbul etdikləri halda, imami şiələri belə bir şeyi qəbul etməyiblər. Onlar deyiblər ki, imamı tanıdan xəbərlər mütləq "cəli" olmalıdır, yəni mənaları çox aşkar olmalıdır, bu cür xəbərlərdə ola biləcək istənilən gizli məna xəbərin məqsədinə xələl gətirir. Digər böyük şiə alimi İbnul-Mutahhər əl-Hilli bu sözlərin şərhində ət-Tusi'nin dediklərini təsdiqləyir və deyir: "(İmami şiələr) onu (yəni imamı) bilməyin yolunun xüsusilə cəli nass olmasını belə dəlilləndirirlər ki, imam həm kiçik, həm də böyük günahlardan məsum olmalıdır… Məsumluq isə o batini işlərdəndir ki, onu yalnız Allah – təalə - bilir, buna görə də imamı bilməyin nassdan başqa yolu yoxdur."[58] Beləliklə də nassın aşkar

---

[55] əs-Sadr, "Durus fi İlmil-Usul", 1/107; Mərkəz əl-Əbhəs, Qum, 1436

[56] əl-Mufid, "Əvail əl-Məqalət", səh: 38; əl-Mutəmər əl-Aləmi, Möhr, 1413

[57] ət-Tusi, "Risələ fi Qavaid əl-Aqaid", səh: 84; Darul-Ğarbə, Beyrut, 1992

[58] əl-Hilli, "Kəşful-Fəvaid fi Şərh Qavaid əl-Aqaid", səh: 298-299; Darus-Safva, Beyrut, 1993

olması təkcə etiqadın ağırlığından qaynaqlanmır, bundan əlavə həm də imamda şərt olan bir xüsusiyyətin də mahiyyətindən qaynaqlanır və bu xüsusiyyət məsumluq xüsusiyyətidir. Əlbəttə ki, bir kimsənin məsum olduğunu zahirən bilməyimiz mümkün deyildir, çünki məsumluq batini bir xüsusiyyətdir. Bir kimsənin məsum olduğunu bilməyimizin yeganə yolu Allah tərəfindən gələn xəbər ola bilər. ət-Tusi'nin sözlərinin bənzərini Miqdad bin Abdilləh əs-Səyuri əl-Hilli (vəfatı h. 826) də təsdiqləyərək yazır: "Bizim əshabımız imamilər və keysanilər dedilər ki, nassın olması labüddür. Zeydilər və carudilər isə (imamları tanımaqda) gizli, qapalı nass ilə və ya (imamın) qiyam/üsyan etməsi, insanları özünə çağırması ilə kifayətləndilər. Bizim əshabımız isə cəli nassın olmasını vacib gördülər."[59] əs-Səyuri özü "cəli nass" ilə "gizli nass" ayırımını belə izah edir və deyir: "Cəli nass, yəni bir və ya birdən çox müqəddiməyə ehtiyac duymayan… Gizli nass isə bir və ya daha çox müqəddiməyə ehtiyac duyan (nasdır)…"[60] O cümlədən Cəməluddin əl-Kəf'ami yazır: "İmamilər dedilər: (İmam) təyini üçün yeganə yol ya sözlə, ya da fel ilə cəli olan nasdır…"[61] əl-Hilli yuxarıda önəmli bir nöqtəyə toxundu. Əgər imami şiələri imamın məsum olmasını şərt görürlərsə o zaman belə bir imamın təyinatı mütləq Allah və ya Allahın elçisi tərəfindən aşkar sözlərlə, şübhəyə yer buraxmayacaq ləfzlərlə gəlməlidir. Mətnaltı mənalardan, gizli işarələrdən, məzmunun dəlalətindən asılı olan xitablar ilə insanların kimin məsum bir imam olacağını gözləmək olmaz. Zeydi şiələri təbii ki, imamın məsum olduğuna inanmadıqları üçün təyinatın aşkar şəkildə edilməsini də şərt görmürlər. Üstəlik imamlıq məqamı dində ən azından peyğəmbərlik məqamı qədər ağır bir məqamdırsa dəlilləri də o qədər ağır olmalıdır. Şiə alimi Muhəmməd Rida əl-Muzaffər yazır: "Etiqadımız budur ki, imamlıq nass ilədir: Etiqad edirik ki, imamlıq da peyğəmbərlik kimi yalnız Allah-Taala tərəfindən təyin olunmuş bir nəss ilə gerçəkləşir. Bu təyinat, ya Allahın elçisinin dili ilə və ya nass ilə təyin olunmuş imamın - özündən sonrakı imamı təyin etmək istədikdə - dili ilə baş verir. Bu məsələdə imamətin hökmü ilə peyğəmbərliyin hökmü arasında heç bir fərq yoxdur… Çünki imamət yükünü daşımağa və bütün bəşəriyyəti hidayət etməyə ruhən və mənən ləyaqətli olan şəxs yalnız Allahın bildirməsi ilə tanınmalı və yalnız Onun təyini ilə imam olaraq müəyyən

---

[59] əs-Səyuri, "əl-Ləvami əl-İləhiyyə", səh: 259;

[60] Eyni mənbə: səh: 274 və 276

[61] əl-Kəf'ami, "Məaricul-Əfhəm ilə İlm əl-Kələm", səh: 120; Muəssəsətul-əl-Əələmi lil-Mətbuat, Kərbəla, 1430

edilməlidir."[62] Bu sözlərin üzərində düşündüyümüzdə dərhal ağlımıza belə bir sual gəlir; peyğəmbərlər özləri necə tanınırlar. Bu sualın cavabında deyilə biləcəyimiz ilk şey budur ki, bəzən bir peyğəmbərin gələcəyinin dəlilləri özündən əvvəlki peyğəmbərlərin müjdəsi ilə baş verir. İslam peyğəmbərinin müjdəsi digər kitablarda zikr olunduğu üçün insanlar bir peyğəmbərin gələcəyini gözləyirdilər. Yəhudilər bu barədə o qədər danışırdılar ki, Hicazın ərəbləri də yaxında bir peyğəmbərin çıxacağını gözləyirdilər. Bir peyğəmbər çıxdıqda qorxmadan, təqiyyə etmədən insanları Allahın yoluna dəvət etdi, güzəşt etmədi və Allah tərəfindən göndərildiyinə dair möcüzələr göstərdi, əqli dəlillərlə insanları iqna etdi. Şeyx əl-Muzaffər'in sözünə əsasən imamı tanımaq da bu şəkildə baş verməlidir; yəni konkret və qəti dəlillərlə isbatını tapmalıdır. Ümumi olaraq imam məqamının dində isbat olunması zənn ifadə edən dəlillərə əsaslana bilməz. Həmçinin ayrı-ayrılıqda imamların kimliyini təyin etmək də bunun kimi zənn ifadə edən dəlillərə dayanmamalıdır. əl-Muzaffər'in sözlərinin şərhində şiə alimi deyir: "Nassın açıq-aşkar və aydın olması zəruridir, qaranlıq və mübhəm olmamalıdır. Yəni, nassda Peyğəmbərdən - sallallahu əleyhi və alih - sonra gələcək imamın adı elə şəkildə bəyan edilməlidir ki, insanlarda heç bir şəkk və tərəddüdə səbəb olmasın. Çünki imamət – nübüvvətin yerinə keçdiyi üçün – ağılın zərurəti baxımından Allah Təalaya vacibdir."[63]

Beləliklə də sünnət əhli ilə imami şiələr arasında bu nöqtədə ortaya çıxmış bir neçə fərq görə bilirik. İmamilərə görə imamın təyinatı peyğəmbərin təyinatı ilə eynidir; yəni peyğəmbərlik məqamını heç kim öz əməlləri və fəziləti ilə qazana bilmədiyi halda imamlıq məqamını da heç kim qazana bilməz, bu sadəcə Allahın lütfüdür və layiq gördüyü şəxslərə verər. Sünnət əhli isə imamın, xəlifənin "həll və əqd" əhli tərəfindən seçiləcəyini deyir. İkinci fərq budur ki, imami şiələrə görə imamət nübuvvət məqamı kimi dinin əsaslarından bir əsasdır, nübuvvət əsası hansı arqumentlərə ehtiyac duyursa imamət məqamı da eyni arqumentlərdən asılıdır. Sünnət əhlinə görə imamət məsələsi dinin füruatına daxildir, üsuldan deyildir. Başqa dildə desək - sünnət əhlinə görə - imam seçmək kollektiv bir məsuliyyətdir, praktiki zərurətdir, amma etiqadla bağlı deyildir. Üçüncü fərq yuxarıda qeyd etdiyimiz kimi imamın məsum olması şərti ilə bağlıdır. Beləliklə də imami şiələrinə görə imamın məsum olması şərtdir, amma sünnət əhlinə görə

---

[62] əl-Muzaffər, "Aqaidul-İməmiyyə", səh: 74;

[63] Həmmud, "əl-Fəvaid əl-Bəhiyyə fi Şərh Aqaid əl-İməmiyyə", 2/65;

məsumiyyət seçilmiş imam üçün şərt deyildir. Onlara görə seçmə məqamında imamın adil olması kifayət edir. Sonuncu fərq isə budur ki, imami şiələrə görə imamların sayı məhduddur, onların kimliyi məlumdur və onlardan heç birində müxalifət etmək olmaz. Onların sayında və kimliyində müxalifət etmək küfrdür, insanı dindən çıxarar və əbədi bədbəxtliyə məhkum edər. Sünnət əhli belə bir say məhdudiyyətinin olduğuna və müəyyən şəxslərin atadan oğula doğru ilahi təyinat ilə seçildiyinə inanmazlar. Bu dörd fərqə diqqət çəkən sünnət əhli məsələni qəti dəlillər üzərində müzakirə etməyi yeganə doğru yol olaraq görürlər. Çünki bu qədər ağır və ciddi mənalar ilə, təhlükəli aqibətlər ilə yüklənmiş bir məsələnin bulanıq, qarışıq dəlilləri ola bilməz. Bu məsələ də tövhid və nübuvvət məsələləri kimi aşkar əqli və nəqli dəlillərə dayanmalıdır.

Bura qədər yazdıqlarımız xəbərlərin dəlalət etdiyi mənaların aşkarlığı və gizliliyi ilə bağlı idi. Yəni imamların kim olması haqqında gələn xəbərlərin dəlaləti o qədər aşkar olmalıdır ki, normal şərtlərdə dəlalət etdiyi məna baxımından heç kimdə şəkk buraxmamalıdır. Burada bir o qədər önəmli olan xəbərlərin sadir olduğu mənbələrin etibarlılığı məsələsidir. Hansısa bir xəbər dəlaləti baxımından qəti olarsa, isnadı baxımından eyni qətiyyəti ifadə etmirsə o xəbər ümumən zənni olaraq qalır. Beləliklə də imamın kimliyinə dəlalət edən xəbərlərin əhəd kimi zənni dəlillər olması kifayət etmir. Bunun üçün Quran və mütəvatir hədislər kimi qəti dəlillər olmalıdır. Şeyx ət-Taifə ət-Tusi yazır ki, "bu kimi məsələlərin dəlili əqldir və ya qətiyyət ifadə edən şəriət dəlilləridir…"[64] Şiə alimi Muhəmməd əs-Sadr bu həqiqəti belə ifadə edir: "İslam alimləri bir mənalı olaraq qeyd ediblər ki, tək xəbərlə - səhih və çoxsaylı olsa belə - mütəvatir həddinə çatmadığı təqdirdə əqidə məsələləri sabit olmur..."[65] Muhəmməd əs-Sadr burada "əqidə məsələləri" deyərək ümumiləşdirmə edir. Doğru olan isə budur ki, bu, bütün əqidə məsələlərinə aid deyildir, lakin əqidə məsələləri içərisində üsul olan mövzularla bağlıdır, çünki əqidə məsələlərinin hamısı üsuldan deyildir. Ona görə də Muhəmməd Sadiq ər-Ruhani bunu dəqiqləşdirərək buyurur: "Tək xəbərin (hüccət olaraq) kifayət etmədiyi yer üsulul-aqaiddir."[66] Yəni əqidə əsaslarıdır. Həmçinin Cəfər əs-Subhəni təsdiqləyərək buyurur: "İmamət şiə əqidəsinə görə o əsaslardandır ki, orada etibara alınan (qətiyyət ifadə edən) elmdir,

[64] ət-Tusi, "əl-Uddə fi Usul əl-Fiqh", 1/130;

[65] əs-Sadr, "Tərixu Mə Bədə əz-Zuhur", səh: 635; Darut-Təaruf, Beyrut, 1412/1992

[66] ər-Ruhani, "Zubdətul-Usul", 4/443; Ənvərul-Hudə, Qum, 1427

orada zənn, təxmin və əhəd xəbərlər kifayət etmir."[67] Biz bu sözlərlə razılaşırıq və bunun arxasında duran məntiq çox aydındır və əsaslıdır. Onu da qeyd edək ki, şiə alimləri burada ümumən imamət məqamının vacibliyini isbat etməklə imamların ayrı-ayrılıqda kimliyini isbat etmək arasında fərq qoyurlar. Ona görə də əş-Şərif əl-Murtəda deyir: "Bizə görə "mütəvatir" imamların ümumilikdə mövcudluğunu və onların hər dövrdə mövcud olmasının vacibliyini sübut etmək yolu deyildir. Bunu isbat etməyin yolu əql və onun dəlilləridir. Mütəvatir yalnız imamların şəxsiyyətlərini və konkret olaraq fılan şəxsin (məsələn, konkret bir fərdin) imam olduğunu, başqasının olmadığını təsbit etmək üçün bir vasitədir. Bununla yanaşı bunu sübut etmək üçün başqa bir yol da mövcuddur ki, o da möcüzədir."[68] Anlamış oluruq ki, əş-Şərif əl-Murtəda bizə imamları tanımağın iki yol ilə mümkün olduğunu deyir; bunlardan biri mütəvatir xəbərlər, digəri isə möcüzədir. Möcüzəyə gəldikdə o, buna şahid olan kəsə nisbətdə imamın kimliyi üçün dəlil ola bilsə də ona şahid olmayan kəslərə nisbətdə dəlil ola bilməz; möcüzəni birbaşa görməmiş kəslərə həmin möcüzənin baş verdiyini deyən xəbərlər mütəvatir olaraq çatmalıdır. Yekunda məsələ yenə də mütəvatirə qayıdır. Ümumi imamətə gəldikdə isə əş-Şərif'in dediyi kimi burada əsas dəlil imami şiələrində əqldir, nəql deyildir. Şeyxut-Taifə ət-Tusi də bunu təsdiqləyir: "İmamın sifətləri bizdə əql ilə bilinir, beləliklə də nəql bura daxil deyildir. Amma imamların fərdlər olaraq şəxsiyyətlərini tanımağa gəldikdə isə bəzən nas və təvatür ilə, bəzən isə möcüzə ilə onları tanıyırıq."[69] Imamların sifətləri dedikdə qəsd etdiyi imamların məsum olmaqları, dövrünün ən fəzilətliləri və ən elmliləri olmaqları kimi vəsfləri qəsd edir.

əş-Şərif əl-Murtəda'nın və ət-Tusi'nin şeyxi əl-Mufid mövzu ilə bağlı çox önəmli məsələlərə toxunur və deyir: "İmamların - aleyhimussələm - şəxsiyyətləri ilə bağlı müzakirə, onlar üçün vacib olan - səhih etibara əsaslanan - xüsusiyyətlər haqqındakı üsuldan asılıdır; beləliklə də bu üsul möhkəm şəkildə təsdiqlənməzsə, onların konkret şəxsiyyətləri haqqında danışmaq mümkün deyildir. Bu üsuldan biri hər dövrdə bir imamın varlığının vacibliyidir, çünki bəndələr üçün ilahi lütfün olması, onların gözəl şəkildə idarə edilməsi və islah olunması zəruridir. Beləki məlumdur ki, insanlar hər zaman ədalətli bir liderin rəhbərliyi altında daha yaxşı vəziyyətdə olur, nizamsızlıq və idarəsizlik

[67] əs-Subhani, "Buhus fil-Miləl van-Nihəl", 7/415; Muəssəsətul-İməm əs-Sadiq, Qum, 1428;
[68] əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İməmə", 1/100;
[69] ət-Tusi, "Təmhidul-Usul", səh: 512; (İntişarat Danişkah Tehran çapında səh: 353)

halına nisbətdə daha az fəsada uğrayır. Bu üsuldan bir başqası da budur ki, imam günahdan məsum, səhv və unutqanlıqdan qorunulmuş olmalıdır: Çünki günah işləyən, hökmlərdə səhvə yol verən və ya həqiqətdən uzaqlaşan bir şəxsin siyasəti ilə xalq əziyyət çəkər. Bu vəsfə sahib olanın arxasında onu qəflət anlarında xəbərdar edəcək və əyrilikdən düzəldəcək bir rəhbərə ehtiyac vardır. Bu üsuldan bir başqası isə budur ki, imamın, ümmətin hökmlərlə bağlı ehtiyac duyduğu bütün biliklərə malik olması vacibdir; əks halda, o, bu məsələlərdə aciz qalar və ona yol göstərən bir başqa rəhbərə ehtiyac duyar, yəni başqa bir imama möhtac olar. Daha bir əsl isə budur ki, imamın Allah yanında dini baxımdan bütün əhalisindən üstün olması vacibdir: çünki o, dini əzəmət baxımından cəmiyyətindən söz və əməldə şübhəsiz üstün olmalıdır və çünki Allah yanında ondan daha üstün olan bir şəxsə nisbətdə dini təzimdə ondan öndə olması imkansızdır, necəki Allah yanında əməl baxımından başqasının daha üstün olduğu halda daha aşağı olan bir şəxsə daha böyük mükafatın verilməsi də qeyri-mümkündür.

Bu üsul sabit olduqdan sonra, İmamın - onun kimliyinə dəlalət edən nass ilə və adəti pozacaq möcüzəvi elm ilə - öz rəiyyəsi içindən fərqləndirilməsi/seçilməsi vacib olur. Çünki bu xüsusiyyətləri özündə cəm etmiş şəxsi tanımağın yeganə yolu ya Allahın peyğəmbərindən olan açıq bəyan və ya möcüzə ilə mümkündür. Eynilə, nübüvvəti və Allahdan gələn risaləti tanımağın yolu, yalnız əvvəlki bir peyğəmbərin açıq bəyanı və ya ağlı heyrətə gətirən aşkar bir möcüzə vasitəsilə mümkündür. Beləliklə də imamların - aleyhimussələm - kimliklərinə dəlalət edən açıq bəyanın (nassın) olması vacibdirsə və bunu Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - sonra möminlərin əmirindən, əl-Həsən, əl-Hüseyn və onların soyundan olan imamlardan başqa heç kəsdə—nə iddia, nə də bəyan yolu ilə - tapa bilmiriksə, o zaman onların həmin imamlar olmaqları yuxarıdakı üsulun doğruluğuna əsasən əqlin şahidliyi və bunu vacib etməsi ilə təsdiqini tapır."[70] Şeyx Mufid'in bu yanaşmasında biz önəmli bir məsələ ilə qarşılaşırıq. O etiraf edir ki, imamların kimliyini, yəni onların müəyyən şəxslər olaraq kimlər olduğunu bilmək bəzi müqəddimələrin isbatından asılıdır və əgər bu müqəddimələr öz təsdiqini tapmazsa o zaman imamın kimliyini bilmək mümkün olmayacaq. Bu üsulun, yəni fundamental əsasların başında gələn əsas və ya əsl ümumiyyətlə

[70] əl-Mufid, "əl-Məsəil əl-Cərudiyyə", səh: 44-46;

imamət məqamının vacibliyini əqli dəlillərlə isbat etməkdir. Əgər bu müqəddimə əqli dəlillərlə isbat olunmazsa o zaman xüsusilikdə imamlar haqqında danışmaq mənasız olur. Hətta bunu isbat etmək də kifayət etmir, bundan sonra imamın məsum olmasının, daha sonra ehtiyac duyulan bütün şəri məsələlərin hökmlərini bilməsinin, daha sonra isə onun öz dövrünün ən fəzilətli şəxsi olmasının zəruriliyini isbat etmək lazımdır. Bütün bunlar təbii ki, Mufidə görə əqli dəlillərə əsasən isbat edilməlidir. Bu əsaslardan birincisi əş-Şərif əl-Murtəda'nın da sözünü etdiyi lütf qaydasıdır ki, onu mötəzililər peyğəmbərlərin mövcudluğu üçün, imami şiələri isə həm peyğəmbərlərin, həm də imamların mövcudluğu üçün ən əsas əqli dəlil olaraq gətirirlər. Kitabımızda ümumən lütf dəlili haqqında məlumat vermişik və bu dəlilin tutarsızlığını şiə alimlərinin öz sözləri ilə göstərmişik. Mufid'in bu sözündən ortaya çıxan nəticə budur ki, imamət məqamının özünün zəruri və vacib olması isbatını tapmadığı üçün imamların şəxsiyyətlərini bilmək də mümkün deyildir.

# İMAMƏT VƏ QURAN

Allah - cəllə cəlaluhu - bütün bəşəriyyətə sonuncu peyğəmbəri Muhəmmədi - salləllahu aleyhi va səlləm - rəhmət olaraq göndərdikdə onunla birlikdə bir hidayət rəhbəri və bir həyat düsturu göndərdi. Bu, müqəddəs kitabımız Qurandır. Allah özü kitabını bizə belə təqdim edir: "Biz Kitabı sənə hər şey üçün bir izah, müsəlmanlara da doğru yolu göstərən rəhbər, mərhəmət və müjdə olaraq nazil etdik." [16:89] Allah aydın şəkildə qeyd edir ki, o bu kitabı hər bir şey üçün bir izah olaraq göndərib, lakin bilirik ki, Quranda elektrik təlimi haqqında və yaxud da qlobal istiləşmə haqqında heç bir şey yoxdur. Ona görə də buradakı "hər bir şey" sözü ilə bizim başa düşdüyümüz hər bir şey qəsd oluna bilməz. Burada "hər bir şey" sözü ilə Quranın nazil olma hədəfi üçün tələb olunan "hər bir şey" qəsd olunmalıdır, yəni Quranın hidayət konseptinin reallaşması üçün şərt olmayan şeylərin bu mənaya daxil deyildir. Allahu təalə buyurur ki, "Həqiqətən, bu Quran (insanları) ən doğru yola yönəldir və yaxşı işlər görən möminlərə, özləri üçün böyük mükafat olacağı ilə müjdə verir." [17:9] O zaman ən doğru yolu təsbit etmək üçün lazım olan hər bir şeyin Quranda olması şərtdir. Şiə təfsir alimlərindən Seyyid ət-Tabətabəi də bu mənanı təsdiqləyərək buyurur: "Çünki bu kitab ümumi insanlar üçün hidayət qaynağıdır və bu onun hədəfidir, belə olduqda, 'hər şey' ifadəsi ilə məqsədin hidayət məsələlərinə aid olan hər şey olduğu aydın olur. Yəni insanların doğru yola yönəlməsi üçün ehtiyac duyduğu, başlanğıc və axirət haqqında həqiqi biliklərdən, üstün əxlaq qaydalarından, ilahi şəriətlərdən, qissələrdən və nəsihətlərdən ibarət olan bütün məsələləri izah edən bir kitabdır."[71] Ona görə də deyiblər ki, Allah - subhənəhu va təalə - "Biz Kitabda heç bir şeyi nəzərdən qaçırmadıq" [6:38] dedikdə bununla Quranı qəsd edir. Digər təfsirə görə isə qəsd olunan Kitab Allahın qatındakı əl-Ləvh əl-Məhfuz'dur. Müasir şiə mərcilərindən əl-Vahid əl-Xorasani bu əhəmiyyətli mövzunu

[71] ət-Tabətabəi, "Təfsirul-Mizən", 12/325;

etiraf edərək deyir: “Hamının diqqət yetirməli olduğu məsələ budur ki, dini biliklərin üsulunun (əqidə məsələləri) kimdən gəldi götürülməsi doğru deyildir. Bu məsələlərin başlanğıc nöqtəsi və müraciət nöqtəsi yalnız iki qaynağa əsaslanmalıdır: Qurani-Kərim və hədislər. Azğınlıqların, sapmaların meydana çıxması isə məhz bu iki mənbədən başqa mənbələrdən götürmək nəticəsində baş verir. Bu məsələlərin üsulu Qurani-Kərimdən, təfərrüatı isə rəvayətlərdən götürülməlidir.”[72] Beləliklə də əl-Xorasani etiraf edir ki, əqidə məsələlərinin üsulu mütləq Qurandan götürülməlidir, bu məsələlərin təfərrüatı üçün rəvayətlərə müraciət edilə bilər, lakin üsul mütləq Quranda sabit olmalıdır.

Müsəlmanın qurtuluşu üçün şərt olan hansısa mərifətin və etiqad əsasının Quranda öyrədilməməsi mümkündürmü? Əgər Allah Quranda bizə qadınların heyz dönəmində bəzi hökmlərini xəbər verirsə, onların iddətlərini xəbər edirsə necə mümkün ola bilər ki, Axirətimiz üçün zəruri olan məlumatlara müqəddəs kitabında yer verməsin?! Quranda həqiqətən də bu cür önəmli və zəruri məlumatların olmadığını deməklə Allahın Kitabı haqqını necə bir təsəvvür formalaşdırmış oluruq? Ona görə də müasir şiə alimlərindən Kamal əl-Heydəri’nin dediyi bu sözlər üzərində düşünməyimiz lazımdır: “Bu, Quranın əsas bir prinsipi sayılır: Quranın hər hansı bir məsələyə toxunması onun həmin məsələyə xüsusi əhəmiyyət verdiyini və ona diqqət ayırdığını göstərirmi, yoxsa göstərmir? Cavabınızı yalnız 'bəli' və ya 'xeyr' şəklində verin, hansını seçirsiniz? Əgər 'xeyr' desəniz, o zaman necə deyə bilərsiniz ki, Quran əsas ox, əsas kitab və İslamın konstitusiyasıdır? Əgər 'xeyr' desəniz, bu fikri necə müdafiə edə bilərsiniz? Buna görə də deməlisiniz ki, Quran bir məsələyə toxunanda, ona xüsusi əhəmiyyət verir, onu öz elmi sisteminin əsas dayaqlarından biri halına gətirir. Əgər bir məsələdən danışmazsa, nə deyəcəksiniz? Quran Əbu Ləhəbdən bəhs etdi və dedi: 'Əbu Ləhəbin əlləri qurusun!' Allah xatirinə deyin: Quranda Əbu Ləhəb daha önəmlidir, yoxsa şiə imaməti? Siz deyirsiniz ki, imamət tövhiddən üstün olmasa da, onunla eyni səviyyədədir. Yəni imamətə inanmayan birinin tövhidi qəbul edilirmi, yoxsa edilmir? Qəbul edilmir. Əgər o, tövhiddən üstün deyilsə, o zaman tövhidin bir şərtidir. Bəs Quran ona toxunub, yoxsa toxunmayıb?”[73] Əlbəttə ki, bu sözlərdə əql sahiblərini düşündürəcək məqam vardır. Abdurrahmən əs-Sadi deyir: “Allah-Təala Qur'anın

---

[72] əl-Xorasani, “Muqtətafət Vələiyyə”, səh: 47;

[73] https://alhaydari.com/ar/2018/12/66540/

şərəfi və əzəməti barəsində xəbər verərək buyurur ki, "{*O, ən doğru olana yönəldir*}", yəni əqidə, əməl və əxlaqda ən adil və ən üstün olana yönəldir. Qur'anın dəvət etdiyi ilə özünə yol tutan kəs bütün işlərində insanların ən kamili, ən doğru yolda olanı və ən hidayət tapmışı olar."[74] Peyğəmbərin - salləllahu aleyhi va sələm - ölümündən dərhal sonrakı halı təsəvvür edək. O zaman İslama yeni gəlmiş müsəlmanların əlində əqidələrini öyrənmək, qurutluşları üçün gərəkli olan elmi tələb etmək üçün tək bir kitab var idi və o, Quran idi. O zaman sünnət hələ kifayət edəcək qədər tədvin edilməmişdi, bir iki səhabənin səhifələrindən başqa sünnətdə əhatəli bir qaynaq kitab yox idi. Sünnət demək olar ki, hələ də səhabələrin köksündə idi. Belə olduğu təqdirdə əlbəttə ki, İslama yeni daxil olmuş insanları cəhənnəm atəşindən xilas etmək üçün kifayət edəcək bir qaynaq olmalı idi; bunun Qurandan başqa bir qaynaq olması mümkün deyildir.

"Həqiqətən, bu Quran (insanları) ən doğru yola yönəldir" ayəsinin izahında İmam Cəfər əs-Sadiq'in "İmama yönəldir" şəklində təfsir etdiyini rəvayət ediblər.[75] Əlbəttə ki, İmam və İmamət etiqadın üsulundandırsa insanları doğru yola yönəldən Quran kitabının İmama yönəltməsi mümkün ola bilməz. Biz kitabımızın bu hissəsində əl-Heydəri'nin sualına yaxından nəzər salacağıq və qarşıya qoyulan dəlillərin həqiqətən də dəlil olub olmadığını yoxlayacağıq. Quran həqiqətən də imamətə yönəldirmi?!

## Qurandakı dəlillərin keyfiyyəti

Üsul elmində alimlər ləfzlərin tələb olunan mənaya dəlalətində aşkarlıq və gizlilik baxımından dərəcələrini müzakirə ediblər. Onlar bu baxımdan mətnləri mənaları aşkar və gizli olaraq iki növə bölürlər. Birinci növ özü də aşkarlıq baxımından iki dərəcəyə ayrılır; nass və zahir. Nass olan ləfzlər o ləfzlərdir ki, onu eşidən yalnız bir məna başa düşür. Zahir olan ləfzlərin dəlalət etdiyi mənalar bir-birilərinə nisbətdə eyni dərəcədə aydın deyildir, çünki bu növ ləfzi

[74] əs-Sadi, "Təysirul-Kərim ər-Rahmən", səh: 454;

[75] əl-Kuleyni, "əl-Kafi", 1/216;

eşidən kəslər ondan iki və ya daha çox məna başa düşə bilərlər, lakin bu mənalardan biri digərinə nisbətdə daha aşkardır. Başqa cür desək nass o növ ləfzlərə deyilir ki, onları təvil etmək olmaz, zahir isə o növə deyilir ki, orada təvil mümkündür. Bəzi alimlər - xüsusilə hənəfilər nassın özünü də üç yerə bölürlər və deyirlər ki, nass olan ləfzlər də özlüyündə aşkarlıq dərəcəsinə görə fərqlənə bilərlər. Bunlardan birincisinə nass, ikincisinə mufəssər, üçüncüsünə möhkəm adını verirlər. Aralarındakı fərq budur ki, nass həm təxsisi, həm də nəsxi qəbul edənə deyilir, müfəssər olan növ isə yalnız nəsxi qəbul edə bilir, möhkəm olanlar isə bunlardan heç birini qəbul etməz. Beləliklə də mənaları aşkar olan ləfzlər aşkarlıq dərəcəsinə görə dörd dərəcəyə ayrıla bilər: 1) möhkəm, 2) müfəssər, 3) nass və 4) zahir. Beləliklə də möhkəm olan ləfzlər nə nəsx, nə təxsis, nə də təvil qəbul edirlər. Müfəssər olan ləfzlər yalnız nəsx qəbul edirlər, lakin təxsis və təvil qəbul etmirlər. Nass olan ləfzlər isə həm nəsx, həm də təxsis qəbul edirlər, amma təvil olunmazlar. Zahir olan ləfzlər isə həm nəsx, həm təxsis, həm də təvil qəbul edirlər.

Mənası gizli olan ləfzlərə isə "mücməl" ləfzlər deyilir. Mücməl ləfzlər o ləfzlərdir ki, orada sözü eşidənlər birdən çox məna başa düşə bilərlər və bunlardan heç biri digərindən daha aşkar deyildir. Hənəfi alimləri dərəcə baxımından mücməl olan ləfzləri də dörd yerə ayırırlar. Bunlar 1) xəfi, 2) müşkil, 3) mücməl və 4) mütəşabihdir. Bu ləfzlərdə gizlilik dərəcəsi birincidən sonuncusuna getdikdə daha da şiddətlənir. Bunların içində mənası ən qapalı, ən gizli olan sonuncudur. Xəfi ləfz ona deyirlər ki, oradakı sözün üslubundakı xüsusiyyət, muradın tam nə mənaya dəlalət etdiyini anlamağa mane olur, məna yalnız kənar dəlillərə əsaslandıqda ortaya çıxır. Misal üçün Allah buyurur: "Oğurluq edən kişi (səriq) və qadının (səriqa) gördükləri işə görə Allahdan bir cəza olaraq əllərini kəsin!" [5:38] Bu ayənin məzar oğrularına dəlalətində gizlilik vardır, çünki ərəb dilində məzarları qazıb kəfənləri oğurlayanlara "nəbbəş" deyilir, üslub olaraq bu iki söz arasında, yəni "səriq" sözü ilə "nəbbəş" sözü arasında fərq vardır, çünki ərəblər "səriq" sözünü xüsusi hallar üçün işlədirlər, halbuki mahiyyət etibarı ilə hər iki iş oğurluqdur. Belə məqamda müctəhidin əlavə səy göstərib muradı müəyyən etməsi lazımdır. Müşkil olan ləfzlərdə də mənaya dəlalətdə gizlilik vardır, lakin buradakı gizlilik, ləfzin ilk baxışda bir mənaya dəlalət etdiyi halda eyni zamanda özündə gizli bir məna daşıyaraq muradın əksinə də dəlalət edə biləcəyini göstərməsindədir. Misal üçün Allah buyurur: "Qadınlarınız sizin tarlanızdır. Tarlanıza istədiyiniz kimi daxil olun!"

[2:223] Ayədə keçən “ənnə” kəliməsi həm məkan, həm zaman, həm də tərzi ifadə edəcək şəkildə mucməl bir kəlimədir. Bu baxımdan bu ayəni oxuyan kimsə ilk baxışda ayənin anal seksə də icazə verdiyini düşünə bilər, çünki ayə “istədiyiniz kimi daxil olun” deyir və “ənnə” sözünü yer, məkan şəklində başa düşdükdə qadının bədəninin hər bir yerini bunun üçün icazəli görmüş ola bilər. Lakin ayədə tarla sözündə gizlənən məna budur ki, tarla məhsul vermək üçün becərilir, ona görə də buradakı daxil olmaq yalnız qadını hamilə edə biləcək cinsi əlaqəni nəzərdə tuta bilər. Beləliklə də ayədəki “tarla” sözünün işlənməsi anal seksi qadağan etməyə dəlalətdə gizlidir. Bu növ dəlalətləri hənəfi alimləri “müşkil” adlandırırlar. Üçüncü yerdə “mücməl” dəlalət gəlir. Mücməl ilə müşkilin arasındakı fərq budur ki, müşkil ləfzlərdəki mücməl sözlərin hansı mənaya dəlalət etdiyini bir qədər təfəkkür, dil analizi etməklə başa düşmək olur, lakin tam mücməl olan ləfzlərdə bunu etmək mümkün deyildir. Misal üçün Allah - cəllə va alə - buyurur: “Boşanmış qadınlar üç qur müddəti gözləməlidirlər.” [2:228] Buradakı qur kəliməsi ərəb dilində həm heyz müddətini, həm də qadının heyzdən təmiz olduğu müddəti də ifadə edə bilir. Mücməldəki məna ilə muradın nə olduğunu yalnız o sözlərin sahibinin öz izahı ilə bilmək mümkündür. Bu növ ləfzlərdə muradın nə olduğunu öyrənməyə ümid vardır, bunun üçün danışanın başqa sözlərinə nəzər salmaq lazımdır. Mücməl ilə mütəşabih arasındakı fərq isə burada özünü göstərir, çünki mütəşabihdə muradın nə olduğunu bilmək ümidi yoxdur.[76]

Bunu bəyan etdikdən sonra Quranın etiqad məsələlərinə dəlalətindəki aşkarlığa nəzər salmağımız lazımdır. Sünnət əhlinin nəzərində imanın şərtlərinin hamısı Qurandakı ayələrdən aşkar şəkildə anlaşılır. İmanın bu şərtləri məhz o məsələlərə deyilir ki, onları inkar etmək sahibini dindən kənara çıxarır, belə bir kimsənin imanı səhih olmaz. Allah - təbərakə va təalə - buyurur: “Ey iman gətirənlər! Allaha, Onun Peyğəmbərinə, Peyğəmbərinə nazil etdiyi Kitaba və daha əvvəl nazil etdiyi kitablara iman gətirin! Kim Allahı, mələklərini, kitablarını, peyğəmbərlərini və axirət gününü inkar edərsə, (haqdan) uzaq bir zəlalətə düşmüş olar.” [4:136] Bu ayədə Allah bizə iman etməyimiz vacib olan şeyləri bəyan edir; Allaha, peyğəmbərlərinə, kiablarına, mələklərinə və Axirət gününə iman etmək iman ilə küfrü ayıran bir xətt olaraq göstərilir. Bir başqa ayədə Allahu təalə deyir: “Yaxşı əməl üzünüzü məşriqə və məğribə tərəf çevirməyiniz deyildir. Lakin yaxşı əməl (sahibləri) Allaha, Axirət gününə, mələklərə, kitablara,

[76] İyad əs-Suləmi, “Usul əl-Fiqh əlləzi lə yəsəu əl-Fəqihə Cəhluhu”, səh: 417-431;

peyğəmbərlərə iman gətirən, sevdiyi malı qohum-əqrəbaya, yetimlərə, kasıblara, müsafirlərə, dilənənlərə və kölələrin azad edilməsinə sərf edən, namaz qılıb zəkat verən, əhd bağladıqda əhdlərini yerinə yetirən, sıxıntı və xəstəlik üz verdikdə, habelə döyüşdə səbr edən şəxslərdir. Onlar imanlarında doğru olanlardır. Müttəqi olanlar da elə məhz onlardır." [2:177] Bu ayədə də imanın şərtlərindən beşi bir arada qeyd edilir. Bəzi ayələrdə Allah - cəllə cəlaluhu - bu şərtlərdən ikisini və ya üçünü və ya dördüncü, ya da yalnızca birini zikr edir. Bu ayələrdən birində deyilir: "Peyğəmbər öz Rəbbindən ona nazil edilənə iman gətirdi, möminlər də (iman gətirdilər). Hamısı Allaha, Onun mələklərinə, kitablarına və elçilərinə iman gətirdilər. (Onlardedilər): "Biz Onun elçiləri arasında fərq qoymuruq!" Onlar dedilər: "Eşitdik və itaət etdik! Ey Rəbbimiz! Səndən bağış-lanma diləyirik, dönüş də yalnız Sənədir!" [2:285] Bir başqa ayədə isə deyir: "Kim Allaha və Onun Elçisinə iman gətirməzsə, (bilsin ki,) Biz kafirlər üçün od hazırlamışıq." [48:13] Yenə başqa ayədə Rəbbimiz buyurur: "Allaha və Onun elçilərinə iman gətirənlər – məhz onlar doğru olanlardır." [57:19] Allahın qədərinə, yəni imanın altıncı şərtinə iman etməyə gəldikdə isə bu barədə Quranda varid olmuş ayələrdən biri belədir: "Yer üzündə baş verən və sizin başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, Yazıda (müəyyən edilmiş) olmasın. Şübhəsiz ki, bu, Allah üçün çox asandır." [57:22] Bu ayələr dəlalət baxımından möhkəm nass hökmündədir. İmamət məsələsinə gəldikdə isə Quranda bunun kimi hansısa bir ayə mövcud deyildir. Allah - azzə va cəllə - Kitabında heç bir yerdə imamlara, vasilərə inanmağı imanın şətləri arasında qeyd etmir. İmamət etiqadı nə ümumi şəkildə, nə də müəyyən olaraq heç bir yerdə keçmir; bu o deməkdir ki, Quranda peyğəmbərlikdən üstün və ya ona bərabər və ya ondan kiçik bir mərtəbə olaraq etiqad edilməsi vacib olan bir məqam kimi imamət haqqında heç bir şey gəlmir. Ümumi olaraq gəlmədiyi kimi xüsusi olaraq da kiminsə peyğəmbərdən - aleyhissalətu vassələm - əvvəl və ya sonra kiminsə imam məqamına təyin olunması da zikr olunmur. Şiə alimi əl-Mufid'in bu barədə izahı çox maraqlıdır. O deyir: "Onların "Qurani-Kərimdə möminlərin əmirinin - aleyhissələm - adı açıq şəkildə harada keçir?" deməsinə gəldikdə, biz deyirik ki, bu, Quranın mücməlində sabitdir, amma heç bir ehtimala yer buraxmayan müfəssəl və açıq sözlərdə yoxdur. Əgər Qurani-Kərimdə təfsilli və bəyanlı şəkildə olsaydı, bununla bağlı mübahisə və fikir ayrılığı olmazdı. Lakin sözün möhtəməl bir mənasında bunun mövcud olması, bunun bəşəriyyət üçün bir dəlil olmasına maneə yaratmır, necə ki, Tövrat və İncildəki

Allahın kəlamında Allahın elçisinin - salləllahu aleyhi va əlihi - peyğəmbərliyi və onun müjdəsi mücməl şəkildə mövcuddur… Eyni şəkildə, möminlərin əmirinin - aleyhissələm - imaməti də Quranın aşkar sözlərində keçməsə də, Rəsulullahın - salləllahu aleyhi va əlihi - açıq sözləri ilə təsdiqlənir."[77] Burada önəmli olan bir neçə nöqtə vardır ki, onları təhlil etməyimiz lazımdır. Hər şeydən əvvəl əl-Mufid təsdiqləyir ki, möminlərin əmiri Əli bin Əbi Talib'in - kərraməllahu vachəhu - imamlığı barəsində Quranda mənası aşkar heç bir şey yoxdur, lakin mücməl mənalarda mövcud olduğunu deyir. Bunun dəlili olaraq çox maraqlı bir fakta işarə edir və buyurur ki, "Əgər Qurani-Kərimdə təfsilli və bəyanlı şəkildə olsaydı, bununla bağlı mübahisə və fikir ayrılığı olmazdı." Bu söz çox məntiqli və ağıllı bir sözdür və bu söz həmçinin ümumi imamət etiqadı üçün də keçərlidir, çünki Quranda ümumi imamət məqamına dəlalət edəcək bir ayə olsaydı "bununla bağlı mübahisə və fikir ayrılığı olmazdı." Quranda Əlinin imamətinə dəlalətin mücməlliyini Tövratda Peyğəmbərimizə - aleyhissalətu vassələm - dəlalətin mücməlliyi ilə eyniləşdirmək də iki nöqtədən xətalıdır; hər şeydən əvvəl Tövrat və İncildə bir peyğəmbərin gələcəyinə dair dəlillər mücməl yox, aşkardır və həmin peyğəmbərin vəsfləri də aşkardır. Quranda isə buna bənzər heç bir şey yoxdur. İkincisi isə Muhəmmədin - salləllahu aleyhi va səlləm - nübuvvətinə dair hüccət Tövratda və İncildə keçən cümlələrlə iqamə olunmamışdı, onun nübuvvəti Quranın açıq-aşkar dəlaləti və möcüzələrlə sabit olmuşdu. Üstəlik iddiaya görə imamlar da keçmiş kitablarda bəyan edilmişdi. Şiələr kitablarında rəvayət edirlər ki, Əlinin peyğəmbərin vasisi olması əvvəlki kitablarda yazılmışdı. Bir rəvayətdə əl-Hüseyndən rəvayət edilir ki, Allahın elçisi – salləllahu aleyhi va əlihi va səlləm – dedi: "Allah hər dəfə bir peyğəmbərin həyatına son qoyduqda ona öz əşirətindən ən yaxın ata qohumları arasından ən fəzilətli birini vəsiyyət etməsini əmr edir və mənə də birini vəsiyyət etməyi əmr etdi. Soruşdum: "Kimə, ey Rəbbim?" Dedi: "Ey Muhəmməd, əmin oğlun Əli bin Əbi Talibə vəsiyyət et, çünki mən bunu keçmiş kitablarda təsdiqləmişəm və orada onun sənin vasin olduğunu yazmışam. Elə bunun üzərindən insanların əhdini, peyğəmbərlərin və elçilərin əhdini almışam. Onlardan Rəbbim olduğuma dair, sənin isə, ey Muhəmməd, peyğəmbər olduğuna dair və Əlinin vəli olduğuna dair əhd aldım."[78] Bir başqa rəvayətdə İmam Əbul-Həsən deyir: "Əlinin vilayəti peyğəmbərlərin səhifələrinin

[77] əl-Mufid, "əl-Məsəil əl-Ukbəriyyə", səh: 45;

[78] ət-Tusi, "əl-Əməli", 1/154;

hamısında yazılıb. Allah elə bir peyğəmbər göndərməyib ki, Muhəmmədin peyğəmbərliyinə və vasisi Əlinin vilayətinə dəvət etməmiş olsun."[79] əl-Hurr əl-Amili bu kimi rəvayətləri qeyd etdikdən sonra deyir: "Bu barədə hədislər xeyli çoxdur; mütəvatir həddini aşıb, min hədisdən çoxdur və bütün hədis kitablarında mövcuddur…"[80] Bu fikrin fəsadı və batilliyi məlum bir məsələdir, çünki Allahın kitabı qarşımızdadır və orada Allahın nəyə dəvət etdiyini görə bilirik və əminliklə deyə bilərik ki, Quranda Əlinin vilayətinə dəvət və çağırış yoxdur. "Səndən əvvəl: "Məndən başqa heç bir ilah yoxdur! Ona görə də yalnız Mənə ibadət edin!" - deyə vəhy etmədiyimiz heç bir peyğəmbər göndərmədik." [21:25]

əl-Mufid'in dediklərinin üzərinə onu da əlavə edə bilərik ki, şiələrdə "Əminul-İslam" ləqəbi ilə tanınan ət-Tabərsi "cəli nass" haqqında danışarkən Qurandan heç bir misal vermir, amma gizli nassa gəldikdə isə Quran ayələrini oraya daxil edir və bunun üçün kitabımızda aşağıda müzakirəsini edəcəyimiz ayələri dəlil göstərir.[81] "Cəli" isə mənası aşkar olana deyilir. Müasir şiə alimlərindən Kəməl əl-Heydəri deyir: "İmamətə və vilayətə dəlil gətirilmiş bütün ayələrin – bu şəkildə, heç birini istisna etmirəm - hamısı (imamətə və vilayətə) müvafiq olmayan məzmunlarla əhatəlidir."[82] Bu o deməkdir ki, şiələrdə qəbul olunmuş mənası ilə imamətə dəlalət etdiyi iddia olunan ayələrin heç biri məzmun baxımından imamətə dəlalət etmir. Əksinə məzmunlar ayələrin məhz başqa mənalarda olduğunu göstərir. Bir başqa şiə alimi Əbul-Qasim əl-Xoyi'nin etdiyi maraqlı bir müzakirənin burada qeyd edilməsi yerinə düşür. Şiələrin içində Quranın təhrif edildiyini iddia edənlərin gətirdikləri arqumentlərdən biri də budur ki, Əlinin imaməti ilə bağlı ayələri Əbu Bəkr və Ömər Qurandan çıxarıb. Bu fikirdə olanların sözlərini rədd etmək üçün və məsələnin heç də belə olmadığını sübut etmək üçün əl-Xoyi yazır: "İki şeyxin (Əbu Bəkr və Ömərin), onların liderliklərinə xələl gətirən ayələri qəsdən təhrif etmələri ehtimalına gəldikdə isə, bu da qətiyyətlə rədd edilir. Həqiqətən, Möminlərin əmiri - əleyhissalam -, onun həyat yoldaşı Saf və Siddiqə Xanım - əleyhəssalam - və bir qrup səhabəsi xilafət məsələsində iki şeyxə qarşı çıxdılar. Onlar Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - eşitdikləri ilə onlara qarşı dəlil gətirdilər və bu barədə mühacir və ənsardan olan

---

[79] əs-Saffər, "Bəsair əd-Dəracət", səh: 92;

[80] əl-Amili, "əl-Fusul əl-Muhimmə fi Usul əl-Əimmə", 1/425;

[81] ət-Tabərsi, "İləmul-Vara bi Əaləmil-Hudə", 1/321-324;

[82] https://alhaydari.com/ar/2012/09/38265/

şahidləri dəlil göstərdilər. Həmçinin Qədir-Xum hədisi və digər sübutlarla onlara qarşı çıxdılar. Əl-İhticac kitabında, on iki kişinin xilafət məsələsində Əbu Bəkrə qarşı etiraz etdiyi və bu məsələdə açıq şəkildə Əlinin təyin edilməsini qeyd etdiyi bildirilir.[83] Allamə əl-Məclisi, Möminlərin əmirinin - əleyhissalam - xilafət məsələsindəki dəlillərinə həsr olunmuş bir fəsil yazmışdır. Əgər Quranda onların (yəni Əbu Bəkr və Ömərin) liderliyinə xələl gətirəcək bir şey olsaydı, bu cür mübahisələrdə (həmin ayələrin) qeyd edilməsi daha uyğun və bütün müsəlmanlar tərəfindən istinad edilməsi daha münasib olardı, xüsusilə də xilafət məsələsinin onların iddiasına görə Quranın toplanmasından çox əvvəl ortaya çıxdığını nəzərə alsaq. Xilafətin başlanğıcında və ya Əli - əleyhissalam - xilafətə çatdıqdan sonra səhabələrin bunu qeyd etməməsi, həmin təhrifin baş vermədiyinə dair qəti sübutdur."[84] əl-Xoyi'nin bu sözləri aşkar şəkildə dəlildir ki, Əli bin Əbi Talib - radiyallahu anhu - heç bir yerdə və heç bir məzmunda ilk xəlifələrə qarşı Quran ayələrini dəlil gətirməyib. Əgər Quranda Əbu Bəkrin xəlifəliyini etibarsız edəcək hansısa bir ayə olsaydı hamıdan qabaq Əli və onun tərəfini tutan səhabələr bunu əsas gətirərdilər, onların bunu etməməkləri onu göstərir ki, Quranda belə bir ayə yoxdur və olmayıb. əl-Xoyi'nin sözünün nəticəsi budur. Bu həmçinin Kamal əl-Heydəri'nin də etirafıdır. Beləki o deyir: "Buna görə də, biz dedik ki, imamət məsələlərində əgər dəlil rəvayətə əsaslanırsa, bu dəlil həm sənəd baxımından qəti, həm də məna baxımından açıq-aşkar olmalıdır. Qurani-Kərim ayəsi ilə bağlı olaraq, sənəd baxımından heç bir problemimiz yoxdur, lakin ayələrin mənası açıq-aşkar olmalıdır. Sizin isə Quranın içində belə bir dəlil tapmağınız mümkün deyil, hətta yeddinci deyil, on dördüncü səma qatına da qalxsanız və ya doqquzuncu yerin altına ensəniz də. Belə bir dəlil tapmazsınız, ancaq desəniz ki, Mehdinin əlində başqa bir Quran var və o, onu ortaya çıxaracaq—bu isə tamamilə başqa bir müzakirə mövzusudur."[85]

Bəlkə də bu problem yaxşı başa düşüldüyü üçün şiə hədis ədəbiyyatına "gizli mənalara" dəlalət edən rəvayətlər sızıb. əl-Kuleyni'nin rəvayətlərindən birində Muhəmməd bin Mənsur deyir: "Mən saleh bir bəndədən Allahın bu kəlamı haqqında soruşdum: "De ki, Rəbbim yalnız açıq və gizli olan bütün pis işləri haram etmişdir."

[83] Bu iddialara kitabımızda cavab veriləcək və bu iddiaların tarixi bir əsasının olmadığı - Allahın izni ilə - göstəriləcək.

[84] əl-Xoyi, "ət-Tibyən fi Təfsir əl-Quran", səh: 217-218;

[85] https://www.youtube.com/watch?v=CWANVm_sXcg

[7:33] O cavab verdi: "Qur'anın bir zahiri və bir də batini mənası var. Qur'anda Allahın haram etdiklərinin hamısı zahirə aiddir, batini mənası isə zülm edən imamları qəsd edir. Eynilə, Allahın kitabda halal etdiyi şeylər zahiridir, batini isə haqq olan imamları qəsd edir."[86] Rəvayətdə saleh bəndə ilə qəsd olunan İmam Musa əl-Kazim'dır. Görünür ki, belə rəvayətə ehtiyacın əmələ gəlməsi Quranda imamlarla bağlı aydın dəlillərin olmaması ilə bağlıdır. Çünki Quran ayələri imamlara dəlalətdə aşkar olsaydı belə bir cavab mənasız olardı. Bu rəvayətlərin ortaya çıxması üçün mövcud olan məzmunu anlamaq da çətin deyildir; çünki imamlar haqqında inanc bu dərəcədə zəruri bir məsələdirsə onun Quranda olmaması heç cür ağlın qəbul etmədiyi bir şeydir. Bu nöqtədən çıxış edərək belə bir inanc formalaşıb ki, Quranın zahirində olmasa da mütləq batinində bu mənalar olmalıdır. Lakin belə bir etiqad əsasının Quranın batini mənalarında olduğunu iddia etmək həddindən artıq problemlidir, çünki belə bir məsələni mərhəmətli Rəbbimizin ayələrin zahirindən uzaqlaşdırıb onların batininə həbs etməsi Onun Hikmətinə yaraşmır. Tanınmış şiə alimi Seyyid Muhəmməd Said əl-Həkim haqlı olaraq buyurur: "İmamət, hər bir tərəf digərini azğınlıq və həlak içində görəcək dərəcədə ümmətin ixtilafının və parçalanmasının ən mühüm səbəblərindən biri olduğu üçün onun lehinə və ya əleyhinə gətirilən dəlillər dəlalət etdiyi mənalarda möhkəmlik və güc baxımından çox aşkar olmalıdır, gecəsi gündüzü kimi parlaq olmalıdır; dəlillər o dərəcədə aşkar olmalıdır ki, onunla hüccət qaldırıldıqdan sonra, dəlalətin aşkarlığından sonra ixtilafa düşmək və bu dəlillərdən kənara çıxmaq sahibinin həlak olmasının və əbədi xüsrana düşməsinin səbəbi olsun.... Buna görə də, imamət iddiasında olan hər bir mübahisə tərəfi və müxtəlif firqələr dəlillərini bu şəkildə gətirməlidirlər. Onlar zəif dəlillərə, təxmini fərziyyələrə, şəxsi ictihadlara və ehtimallara söykənməklə kifayətlənə bilməzlər. Əksinə, möhkəm bir dayağa əsaslanmalıdırlar."[87]

Bura qədər qeyd etdiklərimizdən aydın olur ki, Quran nə ümumi imamət məqamını, yəni peyğəmbərliyə bərabər və ya ondan üstün olan bir imam məqamını bəyan etmir, nə də xüsusilə hansısa bir imamın kimliyini bizə öyrətmir. Əgər imamət məsələsi şəriətdə etiqadi və zəruri məsələlərdən olsaydı bunu Quran bizə bəyan edərdi. Çünki Allah - azzə va cəllə - buyurur: "Həqiqətən, bu Quran (insanları) ən doğru yola yönəldir və yaxşı işlər görən möminlərə, özləri üçün böyük mükafat

[86] əl-Kuleyni, "əl-Kafi", 1/374;

[87] əl-Həkim, "Usulul-Aqidə", səh: 225-227;

olacağı ilə müjdə verir.” [17:9] Bir başqa ayədə buyurur: “Biz Kitabı sənə hər şey üçün bir izah, müsəlmanlara da doğru yolu göstərən rəhbər, mərhəmət və müjdə olaraq nazil etdik.” [16:89] Təbii ki, Quranda hər xırda şeyin bəyanı yoxdur, lakin Quranda bir bəndənin Axirətdə qurtuluşu üçün şərt olan və dini üçün əhəmiyyətli olan hər bir şeyin bəyanı vardır və olmalıdır. Axirətdə qurtuluş üçün şərt olan bir şeyi Allahın Öz Kitabında üstü qapalı şəkildə, gizli üslubla bəyan etməsi nə Onun Kitabına, nə də Onun Hikmətinə yaraşan bir şey deyildir. Ona görə də Şeyxut-Taifə ət-Tusi haqlı olaraq buyurur: “Allah deyir: "(Bu Quran) açıq-aydın ərəb dilində (nazil edildi)." [26:195] və deyir: "Biz hər bir elçini ancaq öz xalqının dilində danışan göndərdik (ki, haqqı onlara bəyan etsin)!" [14:4] və buyurur ki, onun içində hər şeyin izahı vardır və deyir: "Biz Kitabda heç bir şeyi nəzərdən qaçırmadıq." [6:38] Necə ola bilər ki, Allah onun aydın ərəb dilində olduğunu, öz qövmünün dili ilə olduğunu və onun insanlar üçün bir bəyan olduğunu vəsf etdiyi halda onun zahirindən bir şey anlaşılmasın?! Məgər bu, onu başa düşmək üçün təfsirə və izaha möhtac duyan bir tapmaca və gizli məna kimi vəsf etmək deyilmi?! Quran belə bir şeydən uzaqdır…”[88] ət-Tusi’nin bu sözləri necə də gözəldir! Həqiqətən də şahid olacağımız kimi Quranın bəzi ayələrindən imamətlə bağlı çıxarılan mənalar ət-Tusi’nin Qurana yaraşdırmadığı mənalar növünə aiddir. İmamətlə bağlı qarşıya qoyulan izahlar və təfsirlər ayələrin zahirindən başa düşülən mənalar deyildir, lakin onların içindəki uzaq ehtimalları müxtəlif təvil üslubları ilə gücləndirmək cəhdləridir. Bu cür təfsirlər ayələri ət-Tusi’nin sözündəki “tapmaca” halına salır. Bunun misalları ilə qarşıda tanış olacağıq.

## Vilayət ayəsi

Qeyd edək ki, vilayət ayəsi şiələrin Quranda ən güclü hesab etdikləri dəlildir. Şeyxut-Taifə ət-Tusi deyir: “Quranda onun imamlığına dair nassa gəldikdə isə buna dəlalət edən ən güclü

[88] ət-Tusi, “ət-Tibyən”, 1 / 4;

(dəlil) Allahın – təalə - bu sözləridir…”[89] və sonra vilayət ayəsini zikr edir. əl-Hilli “Minhəcul-Kəramə” kitabında bu ayəni “birinci burhan” olaraq qeyd edir.[90] Burhan sözü - məlum olduğu kimi - islam alimlərinin terminologiyasında dəlaləti qəti və ya güclü, aşkar olan dəlillərə deyirlər. Biz bunun həqiqətən də burhan olub olmadığına baxacağıq. əl-Kuleyni “əl-Kəfi” kitabında İmam Muhəmməd əl-Baqirdən - aleyhissələm - belə dediyini rəvayət edir: “Allah-Taalə Peyğəmbərinə Əli - aleyhissələm - üçün vilayət təyin etməyi əmr etdi və ona bu ayəni nazil etdi: "Sizin vəliniz ancaq Allah, Onun Rəsulu və iman gətirənlərdir ki, namaz qılar və rüku halında zəkat verərlər" və onların üzərində olanların vilayətini vacib etdi. Onlar bunun nə olduğunu bilmirdilər, buna görə də Allah peyğəmbərinə - salləllahu aleyhi va əlihi - vilayəti onlara izah etməyi əmr etdi, necəki namazı, zəkatı, orucu və həcci izah etmişdi. Bu əmr Allahdan gələndə, Allahın elçisinin - salləllahu aleyhi va əlihi - ürəyi sıxıldı və onların dinlərindən dönəcəyindən və onu yalançı hesab edəcəyindən qorxdu. Beləliklə, ürəyi sıxıldı və Rəbbinə - cəllə cələluhu - müraciət etdi. Sonra Allah ona bu ayəni nazil etdi: "Ey Elçi! Rəbbindən sənə nazil ediləni çatdır; əgər etməsən, onda Onun risalətini çatdırmamış olarsan və Allah səni insanlardan qoruyacaq" [5:67]. Beləliklə, Allahın əmrini yerinə yetirdi və Qədir-Xum günündə Əlinin - aleyhissələm - vilayətini elan etmək üçün ayağa qalxdı. O, camaat namazını elan etdi və insanlara orada olmayanlara məlumat verməyi əmr etdi.” İmam Muhəmməd əl-Baqir - aleyhissələm - dedi: “Fərzlər bir-birinin ardınca nazil oldu və vilayət ən son fərz idi. Sonra Allah-Taalə bu ayəni nazil etdi: "Bu gün sizin üçün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım" [5:3]. İmam Muhəmməd əl-Baqir - aleyhissələm - dedi: “Allah-Taalə buyurur: Bundan sonra sizə başqa fərz nazil olmayacaq; fərzləri sizin üçün kamil etdim.”[91] Beləliklə də bu rəvayətdən anlayırıq ki, vəlayət fərziyyəti Maidə surəsindəki vilayət ayəsi ilə endirilmiş ən son fərzdir.

Bu arqumentin özünü müzakirə etmək üçün hər şeydən əvvəl ayəni şiələrin özlərinin anladıqları mənada təqdim edirik. Şiələrin anlayışına görə ayənin mənası belədir: “**Sizin vəliniz yalnız Allah, Onun Elçisi və iman gətirənlərdir; onlar ki namaz qılır və rükuda ikən sədəqə verirlər.**” Şiələr iddia edirlər ki, bu ayədə “vəli”

[89] ət-Tusi, “Təlxis əş-Şəfi”, 2/10;

[90] əl-Hilli, “Minhəcul-Kəramə fi Mərifətil-İməmə”, səh: 115;

[91] əl-Kuleyni, “əl-Kəfi”, 1/289;

sözü ilə qəsd olunan məna hakim, idarə edən, xəlifədir. Beləliklə də möminlərin üzərində hökm etmək, idarə etmək haqqı yalnız Allaha, Onun Elçisinə və bəzi sifətləri özündə daşıyan möminlərə aiddir. Şiələr həmçinin əlavə edirlər ki, burada "möminlər" sözü cəm olaraq gəlsə də qəsd olunan tək bir nəfərdir, çünki namaz qılan və rüku halında sədəqə verən şəxs tarixdə bir nəfər olub və o, Əli bin Əbi Talibdir. əl-Alləmə əl-Hilli "Kəşful-Murad" kitabında yazır ki, "təfsir alimləri bu ayədəki muradın Əli - aleyhissələm - olmasında ittifaq ediblər."[92] "Minhəcul-Kəramə" kitabında isə iddia edir ki, ayənin "Əli haqqında nazil olmasında icma ediblər."[93] Baqir Şərif əl-Quraşi isə yazır ki, "sünnilərin və şiələrin təfsir və hədis alimləri ittifaq ediblər ki, ayə möminlərin əmiri (Əli) haqqında nazil olub…"[94] Bu sözün eynisini iraqlı şiə alimi Abdullah Şubbər "Həqqul-Yəqin" kitabında deyir.[95] Həmçinin İbrahim əl-Musəvi əz-Zəncani ən-Nəcəfi imami şiələrin etiqadı barəsində yazdığı kitabında bu sözlərin eynisini olduğu kimi qeyd edir, yəni o da iddia edir ki, sünni və şiə təfsir və hədis alimlərinin hamısı ayənin Əli haqqında nazil olmasında ittifaq ediblər və əlavə edir ki, "bu, altı səhih kitabda zikr olunur."[96] Altı səhih kitab ilə çox ehtimal ki, əhlüs-sünnətdəki altı hədis kitabını qəsd edir, beləliklə də bunun hətta əl-Buxari və Muslimin "əs-Sahih" kitablarında keçdiyini də iddia etmiş olur. "əl-Muracəat" kitabının sahibi Abdulhüseyn Şərəfuddin əl-Musəvi də yazır ki, bu barədə gəlmiş səhih hədislər əhlul-beyt imamlarından mütəvatirdir. Sonra da əlavə edir ki, "ayənin Əli haqqında nazil olmasında təfsir alimləri ittifaq ediblər."[97] Bu mübaliğəli iddialar haqqında qarşıda söz açılacaq.

Şiə alimlərinin ayədən dəlil çıxarmaq metodları bir-neçə addımla baş verir. Əvvəlcə isbat etməyə çalışırlar ki, ayədə "rüku halında zəkat verənlər" sözü məhz fiziki olaraq namazda sədəqə verənlər deməkdir. İkinci addım olaraq bu nəticədən hərəkət edərək ayənin bütün möminlər haqqında ola bilməyəcəyini söyləyirlər, çünki bütün möminlər rüku halında sədəqə vermirlər. Bu addımı isbat etdikdən sonra ayədəki "vəli" sözünün dost mənasında olmadığını irəli sürürlər

---

[92] əl-Hilli, "Kəşful-Murad fi Şərh Təcrid əl-İtiqad", səh: 345;

[93] əl-Hilli, "Minhəcul-Kəramə fi Mərifətil-İməmə", səh: 115;

[94] əl-Quraşi, "ər-Rasul əl-Azam Mə Xuləfəihi", 1/18;

[95] Şubbər, "Həqqul-Yəqin fi Mərifəti Usul əd-Din", 1/192;

[96] əz-Zəncani, "Aqaid əl-İməmiyyə əl-İsnə Aşəriyyə", 1/81-82; Muəssəsətul-Alə lil-Mətbuat, Beyrut, 1982

[97] əl-Musəvi, "əl-Muracəat", səh: 160; Muəssəsətul-Vafə

və deyirlər ki, əgər dost mənasında deyilsə o zaman mütləq hakim, imam, idarəedən mənasında olmalıdır. Misal üçün ikinci addımı isbat etmək üçün əş-Şərif əl-Murtəda deyir: “Ayədə "vali" (وَلِي) kəlməsinin imamət mənasında olduğunu göstərən dəlil budur ki, əvvəlcə "iman gətirənlər" ifadəsinin ümumi mənada bütün möminlərə aid olmadığı, əksinə bir hissəsinə aid olduğu sabit olmuşdur. Bu, xüsusi bir sifətə malik olan müəyyən bir şəxsdir – yəni rükuda zəkat verən şəxsdir. Çünki Allah-Taala, Özündən və Rəsulundan - salləllahu aleyhi və alih - sonra vəlimiz olaraq bildirdiyi kəsi həm iman sifəti ilə, həm də rükuda zəkat vermək sifəti ilə vəsf etmişdir. Beləliklə, bu iki sifətin birlikdə nəzərə alınması vacib olur. Biz bilirik ki, ikinci sifət, yəni rükuda zəkat vermək, bütün möminlər üçün ümumi deyil. Çünki müxaliflərimiz bu əməldə başqalarının da möminlərin əmirinə - əleyhissələm - şərik olduğunu mümkün göstərmək üçün əllərindən gələni etsələr də, bunu hər bir möminə şamil edə bilməzlər…Ayənin bütün möminlərə deyil, müəyyən bir qisminə aid olduğu sabit olduqda və Allah-Taalanın vəhyi ilə bizə bildirərək, həmin mömini bizə vali (vəli) təyin etdiyi məlum olduqda, bu hal xüsusiləşməni tələb edir və həmin vəsfin, adı çəkilən şəxs istisna olmaqla, başqalarına aid olmadığını göstərir. Çünki "İnnəmə" (إِنَّمَا) ifadəsi zahiri mənası etibarilə yalnız bu şəxsi nəzərdə tutur və başqalarının bu sifətə daxil edilməsini inkar edir.”[98] Bu addımı təqdim etdikdən sonra əş-Şərif əl-Murtəda deyir: “Buna görə də, ayədəki "vali" (وَلِي) kəlməsindən məqsədin imamət və idarəetməyə xas olan bir mənaya qayıtması vacibdir. Çünki bu kəlmənin ehtiva edə biləcəyi digər məna – yəni dində dostluq və sevgi – heç bir xüsusiliyə malik deyil və möminlərin hamısı bu mənada ortaqdır. Quran da bunu açıq şəkildə belə ifadə etmişdir: "Mömin kişilər və mömin qadınlar bir-birinin dostlarıdır" [9:71]. Beləliklə, kəlmənin "dində dostluq" mənasında olması batil olduqda, onu bizim izah etdiyimiz mənaya yönəltmək vacib olur. Çünki bundan başqa heç bir ehtimal mövcud deyil.”[99] Beləliklə də gördüyümüz kimi ayənin ümumilikdə imamətlə bağlı olduğunu, xüsusilikdə Əlinin xəlifəliyinə aid olduğunu sübut etməkdən ötrü əş-Şərif əl-Murtəda kimi böyük bir alim kompleks təvil əməliyyatlarından keçməlidir. Çünki ayədən birbaşa bir məna çıxarmaq mümkün deyildir, əksinə ayənin zahiri və məzmunu “dostluq” və “sevgi” mənalarına dəlalət edir. Şiə aliminin qarşısına qoyduğu birinci hədəf bu aşkar mənaya şübhə gətirmək, daha sonra gizli mənanı bir-

[98] əş-Şərif, “əş-Şəfi fil-İmamə”, 2/219-220; əd-Dirayəti təhqiqində 3/69-70;

[99] Eyni mənbə, 2/221, əd-Dirayəti: 3/71

neçə addım ilə isbat etməyə çalışmaqdır. Bu, hər şeydən əvvəl bu ayəni "gizli dəlil" hesab edən şiə alimlərini başa düşməkdə bizə kömək edir.

Gördüyümüz kimi şiələrin üslubundan anlaşılır ki, ayə özlüyündə Əlinin xəlifəliyinə dəlalət etmir, lakin ayənin nazil olma səbəbi haqqında gələn xəbərlər əsasında bu mənaya dəlalət edir. Ona görə də bu nöqtədəki bəhsimiz əslində hədis bəhsi olmalıdır. Lakin hədis bəhsinə keçmədən əvvəl ayənin özü haqqında bəzi maraqlı və əhəmiyyətli nöqtələrə toxunmaq lazımdır. Çünki bir ayəni doğru anlamaq üçün mütləq onun məzmununa baxmaq lazımdır, həmçinin Quranın üslublarına vaqif olmaq lazımdır. Ona görə də hər şeydən əvvəl gəlin birlikdə ayənin siyaqına, məzmununa fikir verək. Görək həqiqətən də ayənin məzmunu, ayədəki "vəli" sözünün hakimiyyət, xəlifəlik mənalarına dəlalət etdiyini, yoxsa "dostluq, himayə, sevgi" mənalarına dəlalət etdiyini dəstəkləyir. Allahu – təalə - buyurur: "**Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizlərdən kim onları (özünə) dost tutarsa, o da onlardandır. Allah zalım adamları doğru yola yönəltməz.**" (51) **Sən qəlbində xəstəlik olanların: "Qorxuruq ki, başımıza bir fəlakət gələ"– deyərək onların (Kitab əhli) arasında vurnuxduqlarını görürsən. Ola bilsin ki, Allah qələbə (bəxş etsin) və ya dərgahından bir əmr versin və onlar ürəklərində gizlətdiklərindən peşman olsunlar.**" (52) "**İman gətirənlər isə deyəcəklər: "Sizinlə bərabər olacaqlarına dair Allahın adı ilə möhkəm and içənlər bunlardırmı?" Onların əməlləri puça çıxdı, özləri də ziyana uğrayanlardan oldular.**"(53) **Ey iman gətirənlər! Sizlərdən hər kim dinindən dönsə, Allah (onun əvəzinə) Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah (hər şeyi) Əhataedəndir, Biləndir.**" (54) Bu ayələri qeyd etdikdən sonra Allah - təbərakə va təalə - vilayət ayəsini zikr edir. Bura qədər keçən ayələrdən biz yalnız himayə, dostluq və sevgi mənalarını görürük, hakimiyyət və xəlifəlik haqqında heç bir açıq söz və ya işarə yoxdur. Daha sonrakı ayələrdə Allah buyurur: "**Kim Allahı, Onun Elçisini və iman gətirənləri (özünə )dost tutarsa, (bilsin ki,) qələbə çalanlar da məhz Allahın firqəsidir.**" (56) "**Ey iman**

**gətirənlər! Sizdən əvvəl Kitab verilənlərdən dininizi ələ salıb oyun-oyuncaq hesab edənləri və kafirləri (özünüzə) dost tutmayın. Əgər möminsinizsə, Allahdan qorxun.**" (57) Beləliklə də vilayət ayəsinin məzmunu, yəni özündən əvvəlki və sonrakı ayələr himayə, dostluq və sevgi mənalarından danışır. Ona görə də bu ayəni tərcümə edən müsəlmanlar və ya qeyri müsəlmanlar ayədəki "vəli" sözündən "dost" və "himayədar" mənasını başa düşüblər. "**Sizin dostunuz yalnız Allah, Onun Elçisi və iman gətirənlərdir.**"(55) Qeyri müsəlman tərcüməçilərdən rusların Kraçkovskisini misal verə bilərik, o da eyni mənada tərcümə edir və deyir: "Ваш покровителü - толüко Аллах и Его посланник и те, которые уверовали, которые выполняют молитву и дают очищение, и они преклоняются." Həmçinin məşhur ingilis orientalis George Sale də öz tərcüməsində ayəni belə qeyd edir: "Verily your protector is God , and his apostle , and those who believe…"[100] Bu məna məzmundan çox aşkar anlaşılır. Əgər digər dillərə də nəzər salsaq eyni nəticə ilə qarşılaşacağıq. Ona görə də Fəxruddin ər-Razi deyir ki, "əvvəlki ayələrdə kafirləri dost edinməyi qadağan etdiyi üçün bu ayədə sevilməsi vacib olan kəsləri dost edinməyi əmr edir.."[101]

əş-Şərif əl-Murtəda'nın ayənin Əli haqqında olduğunu isbat etmək üçün seçdiyi arqumentlər də ən yumşaq dildə desək mübahisəlidir. O deyir: "Ayənin möminlərin əmiri - aleyhissələm - barəsində onun rüku halında üzüyünü sədəqə verməsinə görə nazil olması haqqındakı xəbərin iki fərqli tayfanın nəqli ilə, həm əl-ʿamma (sünnilər), həm də əl-xassa (şiələr) tərəfindən varid olması bunun dəlillərindəndir; bu barədəki hekayə məşhurdur. Nəql əhlinin üzərində ittifaq etdiyi belə bir xəbərin qəti olduğu qənaətinə gəlmək mümkündür."[102] Beləliklə də müzakirəmizin müqəddimələrindən biri budur. Yəni ayənin Əli haqqında nazil olduğunu isbat etmək önəmlidir. Bu ayənin Əli haqqında nazil olmasında təfsir alimlərinin ittifaq etməsi ilə bağlı iddialara gəldikdə isə bunun yalan olması aşkardır. Təfsir kitablarında kiçik bir gəzinti bizə bunun yalan olduğunu göstərir. İbn Atiyyə (2/209), əl-Fəxr ər-Razi (12/386) qeyd edir ki, müfəssirlərin əksəriyyəti bunu Əliyə xas etmirlər. İmam Muhəmməd əl-Baqir'dən

---

100 Sale, "The Koran: Commonly Called the Alkoran of Mohammed", səh: 66; New York, 1880

101 "Təfsir ər-Razi", 12/382;

102 əş-Şərif, "əş-Şəfi fil-İmamə", 2/222; əd-Dirayəti təhqiqində 3/73;

səhih isnad ilə sabit olub ki, bu ayə Əliyə xas deyildir, ümumən möminlərə aiddir. ət-Təbəri deyir: "Hənnəd bin əs-Səriyy bizə rəvayət etdi; dedi: Abdə bizə Abdulməlik (bin Əbi Süleyman)dan, o da Əbu Cəfərdən rəvayət etdi; dedi: "Ondan "sizin vəliniz yalnız Allah, Onun elçisi və iman edənlərdir" ayəsi haqqında soruşdum və dedim: "iman edənlər kimlərdir?" Dedi: "İman edənlərin hamısıdır." Dedik: "Bizə ayənin Əli bin Əbi Talib haqqında nazil olmasına dair xəbər çatıb." Dedi: "Əli də iman edənlərdən biridir."[103] İbn Əbi Hətim ər-Razi deyir: "Əbu Said (Abdullah bin Said) əl-Əşəc bizə rəvayət etdi; (Əbu Muhəmməd Abdurrahmən bin Muhəmməd) əl-Muhəribi bizə Abdulməlik bin Əbi Süleyman'dan belə dediyini rəvayət etdi: "Əbu Cəfər Muhəmməd bin Əli'dən Allahın "sizin vəliniz yalnız Allah, Onun elçisi və iman edənlərdir" ayəsi haqqında soruşdum. Dedim ki, Əli haqqında nazil olub. Dedi: "Əli də iman edənlərdən biridir."[104] Təfsir alimlərinin ən böyükləri, ən məşhurları bu ayənin Əliyə xas olaraq nazil olmadığını, əksinə bütün möminlər haqqında gəldiyini deyirlər.[105] İbn Həcər əl-Heytəmi deyir: "Həmçinin onların bu ayənin Əli haqqında nazil olmasında icma olduğunu iddia etməklərinə gəldikdə isə bu da batildir. Beləki əl-Həsən - onun, böyüklüyü və imamlığı özlüyündə kifayət edir - bunun bütün möminlər haqqında ümumi mənada olduğunu deyir. əl-Baqir də - onu isə tanıtmağa ehtiyac yoxdur - bu nöqtədə onunla razılaşır; ondan bu ayənin kimin haqqında nazil olduğu soruşuldu: Əlidirmi? Dedi ki, "Əli də möminlərdən biridir."[106] Biz təfsir alimlərimizdən sitatlar gətirərək bu sətrlərin sayını ciddi bir şəkildə çoxalda bilərik, lakin məqsədimiz oxucunu yormaq deyildir. Əlbəttə ki, sünnət əhli içində təhqiq əhli sayılmayan alimlərdən bu ayənin Əli haqqında nazil olduğunu deyənlər olub, lakin onlar təfsir kitablarında şiə və ya zəif ravilərin hekayət etdikləri rəvayətlərə əsaslanıblar. Bu rəvayətlər haqqında qarşıda söz açılacaq.

Ayədə "innəmə" ilə məhdudiyyət mənasının gəlməsi heç bir şəkildə bunun möminlərdən kiçik bir qrupa və ya bir nəfərə aid olmasına dəlalət etməz. Çünki məzmundan da anlaşıldığı kimi burada xüsusiləşdirilənlər həqiqi möminlərdir; ayənin dəlaləti münafiqləri və münafiqlərin dostları olan qeyri-müsəlmanları vəli, dost, himayədar olmaqdan çıxarır. əl-Xazin yazır: "Bu sifətləri zikr etməklə qəsd olunan

---

[103] "Təfsir ət-Təbəri", 8/531; Dar Həcər

[104] "Təfsir İbn Əbi Hətim", 4/1162 (6545)

[105] bax: ən-Nəhhəs, "İrabul-Qurab", 1/273; ət-Tufi, "əl-İşərat əl-İləhiyyə", səh: 222-223;

[106] İbn Həcər, "əs-Savaiq əl-Muhriqa", 1/106;

mənа möminləri münafiqlərdən ayırmaqdır, çünki münafiqlər də özlərinin mömin olduqlarını iddia edirdilər, lakin davamlı şəkildə namaz qılmırdılar, zəkat vermirdilər."[107] əz-Zəməxşəri də bunu təsdiqləyir və deyir ki, "burada xalis iman edənlər nifaq ilə iman edənlərdən və ya qəlbləri dillərinə uyğun olsa da əməllərində nöqsanlı olanlardan ayırılır."[108] Bu mənanı dəstəkləyən tərəf budur ki, ayədə sadəcə olaraq "namaz qılanlar və zəkat verənlər" vəsfi keçmir, namaz qılanların və zəkat verənlərin "rüku halında" olduqları qeyd olunur. "Rüku" halında olmaqları isə "qəlbən tam təslimiyyət" deməkdir. Məlumdur ki, ayədəki rüku sözünü xeyli sayda müfəssir "xudu" mənasında, yəni təslimiyyət mənasındakı bir boyun əymək olaraq təfsir ediblər. Nəcmuddin ən-Nəsəfi, əl-Beydavi, Əbul-Həyyan əl-Əndəlusi, İbn Adil əd-Diməşqi, əl-Cələleyn sahibləri, Əbus-Suud, əş-Şəvkəni[109] və başqaları qeyd edir ki, "rüku" burada xudu, təslimiyyət mənasındadır. Həmçinin Cələluddin əd-Dəvani "əl-Hücəc əl-Bəhira" kitabında (səh: 78) bu ayədə rüku sözünün "təvazö" və "xudu" olduğunu deyir.[110] Böyük mötəzili təfsir alimlərindən Əbu Muslim bin Bəhr əl-Əsfəhəni də təfsirində rüku sözünün ayədə "xudu" yəni təvazö və təslimiyyət mənasında olduğunu deyir.[111] əl-Qadi Abdulcəbbar "əl-Muğni" kitabında bunu təsdiqləyərək buyurur: "Bundan sonra sual yaranır: "Və onlar rüku halında zəkat verirlər" ifadəsinin onların iddia etdiyi mənanı verdiyini hardan çıxarırlar? Bu ifadənin mənası belə də ola bilər ki, onlar zəkat verirlər və bu işi təvazökarlıq və itaətkarlıq yolu ilə edirlər, beləliklə də bu təfsir onların zəkat vermək tərzlərini tərifləmiş olacaq. Həmçinin onları zəkatı minnət və əziyyətlə, təkəbbür və üstünlük göstərmək halından çıxamış olacaq. Beləliklə, sanki Allah-Təala onları ən ali təriflə tərifləmiş, onların namaz qılmaqlarını və zəkat verməklərini qürbətin ən güclü formasında vəsf etmişdir və zəkatı vermək halının ən güclü forması bizim bu zikr etdiyimizdir. Halbuki, namaz qılarkən – xüsusən də rüku halında – zəkat vermək öyülən bir xüsusiyyət deyil. Çünki rüku halında olan bir insanın əsas diqqəti və niyyəti etdiyi ibadətə yönəlməlidir və o, başqa bir şeylə məşğul olmamalıdır. Əgər zəkat vermək istəyirsə, bunu namazdan sonra etməlidir. O zaman necə olur

[107] əl-Xazin, "Lubəb ət-Təvil fi Məani ət-Tənzil", 2/56;

[108] əz-Zəməxşəri, "əl-Kəşşəf", 1/648-649; Darul-Kitəb əl-Arabi, Beyrut, 1407

[109] Bax: ən-Nəsəfi, "ət-Təysir", 5/422; əl-Beydəvi (2/132), Əbu Həyyan (4/301), İbn Adil (7/398), "Təfsir əl-Cələleyn" (səh: 147), Əbu Suud (3/52), əş-Şəvkəni (2/60-61)

[110] əd-Dəvvani, "əl-Hucəc əl-Bəhira", səh: 78;

[111] "Təfsir Əbi Muslim əl-Əsfəhəni", səh: 111-112;

ki, ayə onların istədikləri mənaya həml olunur, halbuki ayənin ümumi mənasının qorunmasını təmin edəcək bir izahı qəbul etmək, onu dar mənaya salan bir yozumdan daha düzgündür."[112] əl-Qadi Abdulcəbbar nəinki ayənin bu mənada başa düşülə biləcəyinin mümkün olduğunu deyir, hətta bu cür başa düşməyin mədh məzmununa daha münasib olduğunu göstərir. Əlbəttə ki, əş-Şərif əl-Murtəda bununla razılaşmır və bununla bağlı deyir: "Rüku sözünün təvazökarlıq mənasında yozulmasına gəldikdə isə, bu, açıq-aşkar bir yanlışlıqdır. Çünki rüku kəlməsindən həm dildə, həm də şəriətdə təvazökarlıq və təslimiyyət deyil, yalnız xüsusi bir şəkildə əyilmək başa düşülür. Bir şəxsin itaətkar, təslim (خاضع) olmasını onun rüku halında olması ilə vəsf etmək yalnız bənzətmə və məcaz yolu mümkündür, çünki təvazökar biri üçün ondakı başını aşağı salmaq və lovğalıqdan uzaq olmaq mənasına görə işlədilir. "əl-Ayn" kitabının müəllifi belə deyir: *"Hər bir şey, əgər üzünü yerə yönəldib dizləri ilə yerə toxunursa və ya toxunmursa, amma başını aşağı əyirsə, o, rüku halındadır."* Beləliklə, rüku kəlməsinin həqiqi mənasının məhz bu xüsusi bədən hərəkəti olduğu sabit olursa, onu məcazi mənaya yozmaq yalnız bir zərurət olduqda mümkün ola bilər."[113]

əş-Şərif əl-Murtəda'nın dedikləri ilə razılaşmayan sünnət əhli deyir ki, əksinə Quranda rüku sözü həmişə şəriət örfündəki mənasında işlənmir. Ümumiyyətlə bunu deyən alimlər qeyd edirlər ki, rüku sözünün ərəb dilində bu mənada işlənməsi sabit bir məsələdir. Cahiliyyə şairlərindən əl-Ədbət bin Qurey əs-Sədi bir şerində deyir:

لا تهين الفقيرَ علّكَ أنْ ... تركعَ يوماً والدهرُ قد رَفَعَهْ

"Kasıbı alçaltma, ola bilsin ki,.... sən bir gün rüku edəsən, onu isə tale yüksəltmiş olsun."

Bu sözlərin şərhində ərəb dili alimi Muhəmməd bin Qasim əl-Ənbəri yazır: "Rüku edəsən yəni zəlil olasan, rüku edən ona görə "raki" adlanıb ki, çünki Allah qarşısında zəlil olur..."[114] Bəyanul-Haqq ləqəbli ərəb dili və təfsir alimi Mahmud bin Əbil-Həsən əl-Ğaznəvi (v. h. 553) Bəqara surəsindəki "Rüku edənlərlə birlikdə rüku edin!"[2:43] ayəsinin izahında deyir: "Həmçinin deyilib ki, burada rükunun lüğəvi mənası qəsd olunub və bu, zəlil olmaq, təslim olmaq deməkdir. Yəni

[112] Abdulcəbbar əl-Həmədəni, "əl-Muğni fi Əbvab ət-Təvhid val-Adl", 20-1/135;
[113] əş-Şərif, "əş-Şafi fil-İmamə", 2/230-232; əd-Dirayəti təhqiqində 3/86-88;
[114] əl-Ənbəri, "əz-Zəhir fi Məani Kəlimət ən-Nəs", 2/293;

ki, təslim olanlarla birlikdə təslim olun."[115] əl-Ğaznəvi'yə görə "rüku" sözünün lüğəvi mənası zəif düşmək, zəlil olmaq, təslim olmaq, kiçilmək deməkdir. İbnul-Fəras əl-Əndəlusi də (h. 597) eyni ayənin izahında deyir: "Bizə görə burada üçüncü bir məna vardır; ola bilsin ki, rüku ilə Allah üçün təvazönü, zəlil və təslim olmağı qəsd etmişdir, o zaman rüku ilə şəri mənanı yox, lüğəvi mənanı qəsd etmiş olacaq."[116] Daha sonra əl-Ədbat əs-Sədi'nin şerini misal gətirdi. Əbul-Abbas əl-Qurtubi də eyni şəkildə rüku sözünün ərəb dilində əslinin zəlil olmaq, kiçilmək, təslim olmaq olduğunu deyir. O buyurur: "Rüku sözünü ərəb dilində kökü "xudu" (təslimiyyət) və "zillət" deməkdir. Ərəblərin şairi deyib ki, "fəqiri alçaltma, ola bilsin ki, sən bir gün zəlil olasan, onu isə tale yüksəltmiş olsun." Sonra bu, şəriətdə əyilmək yolu ilə zəlilliyini göstərməyin mənası oldu."[117] Bir digər ərəb dili alimi İbn Mənzur əl-Ənsari "rüku" sözünün izahını lüğəvi olaraq "xudu" mənasında verir, yəni təslimiyyət olaraq izah edir.[118] Böyük təfsir və lüğət alimlərindən Əbu Həyyan əl-Əndəlusi deyir: "Rükunun lüğətdə iki mənası vardır: Birinci məna əyilmə və bükülmə mənasıdır ki, bu, əl-Xəlil və Əbu Zeydin fikridir. Bunun nümunəsi Ləbidin misrasında görünür: "*Ötüb keçmiş əsrlərin xəbərlərini verirəm... Hərəkət edirəm, elə bil ki, hər ayağa qalxdıqda rüku edirəm.*" İkinci məna isə zəiflik və təvazökarlıq mənasıdır və bu, əl-Mufəddal və əl-Əsmai'nin fikridir. əl-Ədbat əs-Sədi də bu mənada belə demişdir: "*Zəifləri alçaltma, ola bilsin ki,... Bir gün sən də rüku edəsən, zaman isə onları ucaltsın.*"[119] İbn Cərir ət-Təbəri "rüku edənlərlə birlikdə rüku edin!" ayəsindəkii rüku mənasını təfsir edərkən buyurur: "Rüku sözünün təvilinə gəldikdə isə bu, Allaha itaətdə xudu (təslimiyyət) mənasındadır. (Ərəb dilində) fılankəs fılankəsə təslim olduqda "rüku etdi" deyirlər. Şairin sözü də bu mənadadır:

بِيعَت بكَسْرٍ لَئِيمٍ واسْتَغاث بها ... مِن الهُزالِ أبوها بعدَ ما رَكَعا

"(Qızı) çox ucuz qiymətə satdı və atası kasıblıq səbəbi ilə rüku etdikdən sonra bundan yararlandı."

---

[115] əl-Ğaznəvi, "Bəhirul-Burhən fi Məani Muşkilət əl-Quran", 1/73;
[116] İbnul-Fəras, "Əhkəmul-Quran", 1/63-64;
[117] əl-Qurtubi, "əl-Mufhim limə Əşkələ min Təlxisi Kitəb Muslim", 2/135;
[118] İbn Mənzur, "Lisənul-Arab", 8/133;
[119] əl-Əndəlusi, "əl-Bəhr əl-Muhit", 1/280;

Yəni əziyyətin və ehtiyacın şiddəti səbəbi ilə əzildikdən/təslim olduqdan sonra…"[120] Bu beyt ərəb şairi İsam bin Ubeyd əz-Zimməni'yə aiddir. əl-Məvardi də "əl-Havi" kitabında rüku sözünə lüğəvi mənada izah verərkən "o, itaət etməklə Allah üçün xudu'dur" deyir və sonra İsamın şerini misal verir.[121] əz-Zəməxşəri də buyurur: "Yəni ki, bunu rüku halında edirlər və bu, həm namazda, həm də zəkatda Allaha xuşu, ixbət və təvazö göstərməkdir."[122] əl-Alusi də qeyd edir ki, "(ayədəki) rüku xuşu deməkdir, çünki Allahu təalənin sözündə (Məryəmə) "rüku edənlərlə rüku et" demişdir və bizdən əvvəlkilərin namazında istilahi olaraq rükunun olmaması icma məsələsidir."[123] Allahu Təalə Məryəmə deyir: "Ey Məryəm, Rəbbinə itaət et, səcdəyə qapan və rüku edənlərlə birlikdə rüku et!"[3:43] Əgər yəhudilərdə namazlarında, dualarında rüku yoxdursa[124] o zaman bu ayədəki rüku mənasının təslim olmaq, mütəvazi şəkildə Allaha tabe olmaq mənalara gəldiyi aşkardır. Şiə alimi ət-Tabərsi də yazır ki, "onların namazlarında rüku olmayıb."[125] Nasir Məkarim əş-Şirazi bəqərə surəsindəki 43-cü ayənin təfsirində yazır: "Lakin burada namazın digər əməlləri arasından yalnız "rükunu" xüsusiləşdirməsi ola bilsin ki, yəhudilərin namazının rükudan tamamilə xali olması ilə əlaqədar ola bilər…"[126] Allah - cəllə cəlaluhu - buyurur: "Onlara: "Rüku edin!" - deyildiyi zaman onlar rüku etməzlər."[77:48] Tacul-Qurra əl-Kirməni ayənin təfsirində deyir: "Yəni ki, "itaət edin və təslim olun!"[127] ən-Nəsəfi deyir: "Allaha qarşı təvazökar olun, Onun vəhyini qəbul edərək və dininə tabe olaraq müti davranın. Bu təkəbbürdən əl çəkin. "Rüku etmirlər" yəni, Onun qarşısında təvazökar olmur, Onun vəhyini qəbul etmir və təkəbbürlərində israr edirlər."[128] Əbu Həyyan əl-Əndəlusi deyir: "Rüku edin! sözünün mənası budur ki, Allaha qarşı təvazökar olun və Onun vəhyinin qəbul edərək müti

---

[120] ət-Tabəri, "Cəmi əl-Bəyan", 1/574; Əhməd Şakir təhqiqi

[121] əl-Məvardi, "əl-Havi əl-Kəbir", 2/115;

[122] əz-Zəməxşəri, "əl-Kəşşəf", 1/649; Darul-Kitəb əl-Arabi, Beyrut, 1407;

[123] əl-Alusi, "ən-Nəfəhət əl-Qudsiyyə", səh: 59;

[124] Yəhudi ravvin Reuven Firestone "Children of Abraham: An Introduction to Judaism for Muslim" kitabında (səh: 146) yazır ki, yəhudi namazında "bəzi əyilmələr olsa da namazların çoxu ya qiyam halında, ya da oturaraq əda olunur. Yalnız ən böyük bayram günlərində, Yeni İldə (Roş Haşanah) və Əfv Günündə (Yom Kippur) yəhudilər namazlarında tam şəkildə səcdə edirlər.

[125] ət-Tabərsi, "Təfsir Məcmə əl-Bəyan", 1/190;

[126] Şirazi, "əl-Əmsəl fi Təfsir Kitəbilləh əl-Munzəl", 1/131; Muəssəsətul-Alə lil-Mətbuat, Beyrut, 2013

[127] əl-Kirməni, "Lubəbut-Təfəsir", səh: 3488

[128] ən-Nəsəfi, "Mədarikut-Tənzil", 3/588;

davranın!"[129] Bu dediklərimiz "rüku" sözünün Quranda "kiçik düşmək", "zəlil olmaq", "təvazö göstərmək", "təslim olmaq" mənalarında gəldiyini göstərir. əş-Şərif əl-Murtəda'nın "rüku" sözünün lüğətdə və şəriətdə yalnız məşhur mənada gəldiyini söyləməsi açıq-aşkar bir xətadır, çünki rüku sözü həm lüğətdə, həm də şəriətdə fərqli mənalarda gəlib. Allah - təbərakə va təalə - Davuddan xəbər verərək deyir: "Davud Bizim onu sınağa çəkdiyimizi yəqinləşdirərək, Rəbbindən özünün bağışlanmasını dilədi və səcdəyə qapanıb tövbə etdi."[38:24] Məlumdur ki, ayədə "وخرّ راكعا" sözləri keçməkdədir və təfsir alimləri buradakı "rüku" sözünün səcdə olduğunu anlayıblar. Məkki bin Əbi Talib əl-Qurtubi deyir ki, "yəni Allaha səcdə edərək."[130] əl-Məvardi deyir: "Yəni ki, səcdə edərək çökdü və bəzən səcdə üçün "rüku" sözü işlədilir."[131] Təfsir alimlərinin "rüku" sözünü burada səcdə olaraq təfsir etməklərinin səbəbi budur ki, ayədəki "xarra" sözü cəld bir şəkildə yerə çökmək, qapanmaq deməkdir, ona görə də "rüku" sözü burada "səcdə" mənasını verməlidir. Quranda eyni şəkildə "səcdə" sözü də təslimiyyət mənasında işlənir. "O zaman Biz dedik: "Bu kəndə daxil olun və orada istədiyiniz yerlərdə, rahatlıqla yeyin için. Qapıdan səcdə edərək daxil olun və: "Bizi bağışla!"– deyin ki, sizin günahlarınızı bağışlayaq".[2:58] Məlumdur ki, burada fiziki olaraq səcdə halında daxil olmaq qəsd oluna bilməz. Ona görə də İbn Cərir ət-Təbəri deyir ki, "xuşu və xudu (təslimiyyət) halında"[132] daxil olun. Rüku sözünün vilayət ayəsində "xudu", "təvazö" və "təslimiyyət" mənasında gəldiyini təsdiqləyən qarinalardan biri də budur ki, özündən əvvəlki ayədə Allah - cəllə cələluhu - buyurur: "Ey iman gətirənlər! Sizlərdən hər kim dinindən dönsə, Allah (onun əvəzinə) Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah (hər şeyi) Əhatəedəndir, Biləndir."[5:54] Burada Allah xeyirli bir qövmdən danışarkən onları "möminlərə qarşı" mülayim olmaqla vəsf edir və ərəb dilində bunun üçün "zəlil" sözü işlənir; yəni möminlərə qarşı münasibətdə zəif, mütəvazi və təslimiyyət içində olurlar. Bu qərinəyə diqqət çəkən mötəzili alimi Əbu Muslim əl-Əsfəhani'dir; beləki ona görə rüku sözünün ərəb dilindəki mənalarından biri də elə məhz

---

[129] Əbu Həyyan, "əl-Bəhr əl-Muhit fit-Təfsir", 10/379;

[130] Məkki, "əl-Hidəyə ilə Buluğ ən-Nihəyə", 10/6222;

[131] əl-Məvardi, "ən-Nukət val-Uyun", 5/89;

[132] ət-Təbəri, "Cəmiul-Bəyan", 1/715; ət-Turki çapı

budur.[133] Bütün bunlar şübhəsiz ki, göstərir ki, rüku sözü, həmçinin səcdə sözü Quranda müxtəlif mənalarda işlənmişdir. Beləliklə də ayədə “innəmə” ilə xüsusiləşdirilənlər “qəlbləri təslim olmuş şəkildə namaz qılıb zəkat ödəyənlərdir.” Bununla da nəinki zahirən kafir olanları, həmçinin batinən də kafir olanları kənarlaşdırmış olur.

Əgər desələr ki, rüku sözünü “xuşu və təslimiyyət” mənalarına həml etmək sözü zahiri istilahi mənadan çıxarıb məcazi mənaya həml etməkdir ki, bu isə dəlilsiz icazəli deyildir. Buna iki cür cavab vermək olar; hər şeydən əvvəl şahid olduq ki, rüku sözünün lüğətdəki əsli mənası haqqında alimlər ixtilaf ediblər; onlardan kimisi bu sözün lüğətdə mənasının fiziki mənada əyilmək olduğunu dediyi halda, kimisi də bunun zəlil olmaq, sınmaq, zəif düşmək, alçalmaq və təkəbbürün əksi olan təvazö və təslimiyyət mənalarında olduğunu deyiblər. İkincisi cavab isə budur ki, rüku sözünün ikinci mənada məcaz olduğunu qəbul etsək belə yenə də ayənin zahirinin buna dəlalət etdiyini deyəcək, çünki “namazda fiziki olaraq əyilib zəkat vermək” mənası aşkar məna deyildir. Əksinə tam təslimiyyət və təvazö ilə zəkar vermək mənası ayədə daha aşkar görünür. Əbu Həyyan əl-Əndəlusi deyir: “Burada rükunun zahiri mənası, namazdakı forma yox, xudu (təslimiyyət) mənasıdır.”[134] Biz deyirik ki, “rüku” sözünün Quranda fərqli mənalarda gəldiyini göstərdik, lakin “zəkat” sözünün Quranda vacib olmayan sədəqə mənasında gəldiyini sübut etmək lazımdır. Ona görə də heç bir dəlil olmadan zəkat sözünü Quranda adətən işlənən mənasından başqa mənaya həml etmək olmaz. Sözün zahiri istilahi mənasını tərk edib ikinci dərəcəli mənaya getməyə şiələrin etdiyini misal vermək olar, bunun misalı “zəkat” sözündə daha aşkardır, çünki Quranda zəkat sözü heç yerdə könüllü sədəqə kimi gəlməyib, üstəlik namaz ilə yanaşı gəldikdə zəkatın fərz olan zəkat mənasını ifadə etməsi çox aşkardır və bunu bu mənadan çıxarıb sədəqə mənasına yozmaq özü zahiri tərk edib ikinci dərəcəli mənaya yönəlmək olacaq. əl-Qurtubi deyir: “Zəkat sözünü üzüyü sədəqə vermək mənasında yozmaq uzaq görünür, çünki zəkat sözü (Quranda) yalnız özünə xas adla gəlir və o, fərz olan zəkatdır…”[135] Bu ayəni Əlinin imamətinə aid etmək üçün bir çox sözü ərəb dilində zahirindən çıxarıb məcazi mənaya həml etmək lazım olur. Bunlardan birincisi “iman gətirilənlər” sözüdür və “iman gətirənlər”

---

[133] əş-Şərif, “əş-Şəfi fil-İmamə”, 2/244-247

[134] Əbu Həyyan, “əl-Bəhr əl-Muhit fit-Təfsir”, 4/301;

[135] əl-Qurtubi, “əl-Cəmi li Əhkəm əl-Quran”, 6/222; Darul-Kutub əl-Misriyyə, Qahirə, 1964

cəm şəklində gəlir. Bu şəkildə üçüncü şəxsə xitab olaraq cəm forma işlədib tək nəfəri qəsd etmək məcazdır, həqiqət deyildir. Digəri isə "zəkat" sözüdür, şəriət örfündə "zəkat" sözü mütləq şəkildə işləndikdə fərz olan zəkata aiddir, onu müstəhəb sədəqə mənasına həml etmək məcazdır, xüsusilə də Quranda heç yerdə namaz ilə yanaşı zəkat sözü müstəhəb sədəqə mənasında işlənməyib. Burada daha bir təvil vardır; ayənin zahiri "vəlilik" sifətinin eyni zamanda həm Peyğəmbərə, həm də iman gətirmiş kəslərə aid olduğuna dəlalət edir. Şiələr əgər "iman gətirmişlər" ilə qəsd olunanın Əli olduğunu deyirlərsə, ayədəki bu zaman baxımından eyniliyi öz zahirindən çıxarıb məcazi mənaya aid etməkləri lazımdır, çünki özləri də etiqad edirlər ki, Əli - radiyallahu anhu - Peyğəmbərin - aleyhissalətu vassələm - vəfatından sonra imam oldu, onunla eyni anda imam deyildi. Burada daha bir zahir odur ki, ayədəki vəsf davamiyyət ifadə edir, yəni keçmişdə bir dəfə baş vermiş hadisə nəzərdə tutulmur. Namaz qılanlar, zəkat verənlər deyildikdə bunun davamlı bir şəkildə baş verdiyi qəsd olunur. Şiələrin təvilinə görə isə burada, keçmişdə bir dəfə baş vermiş bir hadisə nəzərdə tutulur. Bütün bu misallarda şiələr ləfzlərin zahirini tərk edib uzaq ehtimallara gedirlər. Lakin ləfzin zahirini tərk edib möhtəməl mənalara getmək üçün, misal üçün sözü həqiqi mənasından çıxarıb məcazi mənasına həml etmək üçün dəlil olmalıdır, görəcəyimiz kimi belə bir dəlil yoxdur. Şiə alimlərinin ən böyüklərindən Şeyx əl-Mufid özü deyir: "Hər kim Quranı heç bir qəti hüccət olmadan həqiqi mənasından uzaqlaşdıracaq şəkildə təvil edərsə və məcaz və istiarə (metafora) mənasında olduğunu iddia edərsə bununla batilə bulaşmış, haram iş görmüş və zəlalətə düşmüşdür."[136] Buradan anlaşılır ki, "rüku" sözünü təslimiyyət mənasında anlamaq ayələrin məzmununa müvafiqdir. Lakin ayəni şiələrin iddialarına uyğunlaşdırmalı olsaq o zaman ayədəki "vəli" sözünü, "əlləzinə" cəm formasını, "zəkat" sözünü, zaman baxımından bərabərliyi zahiri mənalarından qoparıb məcazi mənalara həml etməli və ayəni öz məzmunundan çıxarmalı oluruq.

Bunları qeyd etdikdən sonra Əlinin rüku halında sədəqə verməsi iddiasına baxmağımız lazımdır. Çünki ayədə şiələrin əsaslandıqları ən əsas dəlil "rüku halında zəkat vermək" mənası ilə bağlıdır. Yuxarıda təqdim etdiyimiz sitatlardan başa düşdünüz ki, şiələr bu barədə gəlmiş xəbərlərin həm sünnilərə görə, həm də şiələrə görə səhih, hətta mütəvatir olduğunu iddia edirlər. Onların ayənin təfsir və hədis

[136] əl-Mufid, "əl-İfsəh fil-İmamə", səh: 177;

alimlərinin ittifaqı ilə Əli haqqında nazil olması iddiasının çürük və yalan olduğunu gördük. İddia etdikləri rəvayətlərə gəldikdə isə bu barədə həm sünnət əhlinin, həm də şiələrin kitablarında rəvayətlər keçir. Sünnət əhlinin kitablarında keçən rəvayətlərə gəldikdə isə bu barədəki rəvayətləri ət-Təbəri təfsirində və başqaları öz kitablarında gətirir. Gəlin bu rəvayətlərə bir-bir nəzər salaq.

ət-Təbəri deyir: “Muhəmməd bin əl-Hüseyn bizə rəvayət etdi; dedi: “Əhməd bin əl-Mufəddal bizə rəvayət etdi; dedi: Əsbət bizə əs-Suddi’dən belə dediyini rəvayət etdi… Lakin Əli bin Əbi Talib məsciddə rükuda ikən yanından bir dilənçi keçdi və (Əli) ona üzük verdi.”[137] əs-Suddi’nin adı İsmail bin Abdirrahmən bin Əbi Kərimə’dir, haqqında ixtilaf edilsə də əksər alimlər onu saduq hesab edirlər. Dəqiq doğum tarixi məlum deyildir, amma dörd xəlifənin ölümündən sonra doğulduğu görünür. Əsbət’in əs-Suddi’dən rəvayət etdiyi təfsir kitabı isə tənqid olunub. İmam Əhməd deyir ki, əs-Suddi’nin “hədisi həsəndir, lakin ondan gələn təfsirə gəldikdə isə onun üçün bir isnad çıxarıb və hamısını onunla rəvayət edir.”[138] Yəni ki, zəif və səhih hər bir şeyi bir isnadla rəvayət edir.

ət-Təbəri deyir: “əl-Haris mənə rəvayət etdi; dedi: Abdulaziz bizə rəvayət etdi; dedi: Ğalib bin Ubeydullah bizə rəvayət etdi; dedi: Mücahidi “Sizin vəliniz yalnız Allah və Rasuludur…” ayəsi haqqında belə deyərkən eşitdim: “Əli bin Əbi Talib haqqında nazil olub, rükuda ikən sədəqə verdi.”[139] Ğalib bin Ubeydullah haqqında əl-Hafiz İbn Həcər yazır ki, “hədis uydurmaqla tanınır.”[140]

ət-Təbərani deyir: “Muhəmməd bin Əli əs-Saiğ bizə rəvayət etdi; dedi: Xalid bin Yezid əl-Uməri bizə rəvayət etdi; dedi: İshaq bin Abdullah bin Muhəmməd bin Əli bin Hüseyn bizə əl-Həsən bin Zeyd’dən, o atasından, o da Zeyd bin əl-Həsən’dən, o isə babasından rəvayət etdi ki, Ammar bin Yasir’i belə deyərkən eşidib: “Əli bin Əbi Talib nafilə namazında rükuda ikən bir dilənçi onun yanında durdu,

[137] “Təfsir ət-Təbəri”, 8/530;

[138] Muğlətay, “İkməl Təhzib əl-Kəməl”, 2/188; əl-Faruq əl-Hədisə, 2001

[139] “Təfsir ət-Təbəri”, 8/531;

[140] İbn Həcər, “Təbyin əl-Acəb bimə Vərədə fi Şərh Racəb”, səh: 46; Muəssəsə Qurtubə

(Əli) üzüyünü çıxardı və dilənçiyə verdi…"[141] Bu rəvayət də yalandır, çünki Xalid bin Yezid əl-Umari yalançı ravidir.[142]

İbn Əbi Hətim ər-Razi deyir: "Əbu Said əl-Əşəc bizə rəvayət etdi; əl-Fədl bin Dukeyn Əbu Nueym əl-Əhval bizə rəvayət etdi; Musa bin Qeys əl-Hədrami bizə Sələmə bin Kuheyl'dən belə dediyini rəvayət etdi: "Əli rükuda ikən üzüyünü sədəqə verdi və …. ayə nazil oldu."[143] Sələmə bin Kuheyl hicri 47-ci ildə Müaviyə bin Əbi Sufyan'ın xəlifəliyi dövründə dünyaya gəlib.

"İbn Mərdəveyh təfsirində Sufyan əs-Səvri yolu ilə Əbu Sinən'dən, o da əd-Dahhək'dən, o isə İbn Abbasdan belə dediyini rəvayət edir: "Əli bin Əbi Talib namaz qılırdı, rükuda ikən yanından dilənçi keçdi, ona üzüyünü çıxarıb verdi və ayə nazil oldu."[144] əz-Zeyləi bu rəvayəti qeyd etdikdən sonra deyir ki, "sənədində qopuqluq var, çünki əd-Dahhək İbn Abbası görməyib." Eyni şeyi İbn Kəsir də deyir. İbn Mərdəveyh bunu həmçinin Muhəmməd bin əs-Saib əl-Kəlbi yolu ilə Əbu Saleh'dan, o da İbn Abbas'dan rəvayət edi, amma əl-Kəlbi yalanda ittiham olunmuş, tərk olunmuş bir ravidir.[145] Həmçinin Abdurrazzəq əs-Sanani'yə nisbət olunan rəvayətdə o bunu Abdulvahhab bin Mücahid'dən, o da atasından, o isə İbn Abbas'dan rəvayət edir.[146] Abdulvahhab bin Mücahid bin Cəbr tamamilə etibarsız biridir; Sufyan əs-Səvri onun yalançı olduğunu deyib. Vaki isə deyib: "Abdulvahhab bin Mücahidin atasından heç bir şey eşitmədiyini deyərdilər."[147] Beləliklə də bu barədə əhlüs-sünnət kitablarında gələn heç bir rəvayət səhih deyildir. Ona görə də İbn Kəsir bu rəvayətləri zikr etdikdən sonra deyir ki, "bunlardan heç biri sənədlərinin zəifliyinə və ravilərinin məchul olmasına görə səhih deyildir."[148]

Şiələrin öz kitablarında gətirdikləri rəvayətlərinə gəldikdə isə bu barədə onların kitablarında səhih xəbər yoxdur. Biz bunu isbat etmək üçün bu xəbərləri qeyd etməyə, onların isnadlarını analiz etməyə ehtiyac görmürük, çünki şiələrin öz aralarından bir şahid bu məqamda

---

[141] ət-Tabərani, "əl-Mucəm əl-Əvsər", 6/218 (6232)
[142] əl-Heysəmi, "Məcmə əz-Zəvaid", 3/296;
[143] "Təfsir İbn Əbi Hətim", 4/1162 (6551)
[144] əz-Zeyləi, "Təxric Əhədis əl-Kəşşəf", 1/409; İbn Kəsir, "Təfsir əl-Quran əl-Azim", 3/138;
[145] İbn Kəsir, "Təfsir əl-Quran əl-Azim", 3/138;
[146] İbn əl-Məğazili, "Mənaqib Əli", səh: 377 (rəq: 354)
[147] əl-Mizzi, "Təhzib əl-Kəməl", 18/516-517;
[148] İbn Kəsir, "Təfsir əl-Quran əl-Azim", 3/139;

kifayət etməlidir. Şiə alimlərindən Muhəmməd Asif əl-Muhsini bununla bağlı yazır: “Bu babda bizim rəvayət yolları ilə gəlmiş sənəd baxımından mötəbər bir rəvayət yoxdur.”[149] Beləliklə də mütəvatir və səhih bir kənarda qalsın, əl-Muhsini qeyd edir ki, ümumiyyətlə şiə rəvayətləri arasında bu barədə mötəbər heç bir şey yoxdur. Bu sənə, əziz oxucu, qarşına çıxan gurultulu və təntənəli iddialara aldanmamağı öyrətməlidir.

İndi gəlin birlikdə ayə ilə şiə qardaşlarımızın anlayışı arasındakı qəribəliklərə və uyğunsuzluqlara baxaq. Aydındır ki, ayə möminləri mədh edir və onların əməllərini tərifləyir. Əgər burada “rüku halında” sədəqə vermək qəsd olunsaydı o zaman sədəqənin bu forması ya vacib, ya da ən azından müstəhəb olmalı idi, çünki ayədə bu şəkildə sədəqə verənlər təriflənmişdir. Halbuki müsəlman millətinin - şiələr də daxil olmaqla - ittifaqı ilə rükuda sədəqə vermək nə müstəhəbdir, nə də vacibdir, əksinə alimlər bu əməlin namazda artıq bir hərəkət olaraq qadağan olmasını müzakirə ediblər. İbn Kəsir deyir: “Bəziləri yanlış güman ediblər ki, burada rüku halında zəkat vermək qəsd olunur. Əgər belə olsaydı zəkatı rüku halında vermək digər hallardan daha əfzəl olmalı idi, çünki burada mədh olunur. Halbuki fətva imamlarından tanıdıqlarımızdan heç kim belə bir şey demir.”[150] Əgər bu əməlin gözəl bir tərəfi olsaydı bunun həm peyğəmbər, həm də səhabələr tərəfindən təkrarlandığını görərdik. Əgər səhabələr bu ayədən “rüku halında sədəqə vermək” mənasını başa düşsəydilər o zaman sədəqələrini rüku halında verməyə can atardılar. Bizə məlumdur ki, səhabələrin içində sədəqə verməklə tanınmış çox sayda şəxsiyyət olub, lakin bunların heç birindən bizə rüku halında sədəqə verməklə bağlı bir xəbər gəlməyib. Necə olur ki, Allah kitabında bir əməli tərifləsin və ya nümunə göstərsin, amma bu əmələ möminlər tərəfindən əməl edilməsin?! Əgər burada murad olunanın bu əməli mədh etmək yox, sadəcə olaraq Əlini vəsf etmək olduğu iddia olunsa[151] o zaman bunun daha qəribə bir hal olduğunu deyərik, çünki Əlini daha aydın, daha sabit vəsflərlə vəsf etmək mümkün idi. Misal üçün peyğəmbərin əmisi oğlu və kürəkəni olması, müharibə sancağı verilmiş şəxs olaraq vəsf oluna bilərdi,

---

[149] əl-Muhsini, “Məşraatu Bihər əl-Ənvar”, 2/85

[150] İbn Kəsir, “Təfsir əl-Quran əl-Azim”, 3/138; Sələmə çapı

[151] əş-Şərif əl-Murtəda “əş-Şəfi fil-İmamə” kitabında (2/244; əd-Dirayəti təhqiqində 3/108) məsələni bu cür izah etməyə çalışır. Müxaliflərin iradına cavab vermək üçün qeyd edir ki, ayə bu əməli mədh etmək üçün gəlməyib, sadəcə olaraq möminlərin içindən məhz Əlini ayırmaq üçün gəlib.

ümumiyyətlə Əli haqqında sabit olmuş məşhur və mütəvatir vəsflərdən biri zikr olunsaydı heç kimsə ayədə qəsd olunanın Əli olduğunda şəkk etməzdi. Əlavə edək ki, şiə təfsirini qəbul etməli olsaq ayədə möminlər üçün iki ayrı vəsfin olduğunu görürük; bu vəsflərdən biri namaz qılmaq, ikincisi isə rüku halında sədəqə verməkdir. Beləliklə də əgər ayədə Əliyə xas sifət qəsd olunursa o zaman "namaz qılanlar" sözü əbəs olacaq, çünki bu, təkcə Əliyə xas deyildir. İddia doğrudursa o zaman Əliyə xas olan tək sifət rüku halında sədəqə verməkdir ki, burada da Allah sadəcə "rükuda ikən sədəqə verənlər" deməli idi.

**Üstəlik** Əli bin Əbi Talib Quranın təfsirini çox gözəl bilirdi. Əgər ayə onun haqqında nazil olmuş olsaydı bunu kütlə qarşısında bir çox münasibətlə dəlil gətirərdi. Burada "Əli təqiyyə edirdi" demək uyğun gəlmir, çünki şiələr özləri nəql edirlər ki, şura günü ğədir rəvayətini, mübahələ ayəsini və digər fəzilətlərini dəlil gətirib, nə üçün Quranda şiələrin ən əhəmiyyətli dəlil saydıqları vilayət ayəsini dəlil gətirməyib?![152] Həmçinin əgər şiələrin verdiyi təfsir doğru olsaydı o zaman bu ayənin gərəyi budur ki, Əli hətta peyğəmbərin sağlığında da möminlərin əmiridir; müsəlmanlara Allaha və rasuluna itaət etmək vacib olduğu kimi Əliyə də itaət etmək vacibdir. Bunun isə batil olduğu aşkardır, çünki Əlinin özünə belə Peyğəmbərə itaət etmək vacib idi. Şəriət eyni zamanda müsəlmanlara itaət etmək üçün iki imam təyin etməz.

Bütün bu dediklərimizdən başa düşülür ki, sözü gedən ayədə imamət təyinatı ilə bağlı heç bir şey yoxdur. Bu həqiqəti görüb başa düşən şiə alimləri etiraf ediblər ki, vilayət ayəsi mənası aşkar olan dəlillərdən deyildir, lakin gizlidir. Əli ət-Təbərsi gizli nasları "qurani və əxbari" olaraq iki yerə ayırdıqdan sonra "Qurandan" olan gizli nass üçün vilayət ayəsini misal verir.[153] Muhəmməd Cəfər əl-Əstərabadi bu ayəni gizli nassın misalları arasında zikr edir.[154] Ona görə də ayənin içində tapmaca formasında gizli olan bu mənanı aşkara çıxarmaq üçün rəvayətlərə ehtiyac yaranıb, yəni yuxarıda qismən müzakirəsini etdiyimiz rəvayətlər olmazsa ayədən belə bir məna çıxarmaq həddindən artıq çətin bir iş olacaq, əslində mümkün olmayacaq. Ona görə də Muhəmməd əl-Mumin əl-Qummi deyir: "Ümumilikdə, "vilayət" (vəli olmaq) kökündən və "vəli" sözündən gələn, bir şəxsin himayəsi

[152] Təfsir ər-Razi, 12/385;

[153] ət-Təbərsi, "İ'ləmul-Vara bi A'aləm əl-Hudə", 1/324;

[154] Şəriətmədar, "əl-Bərahin əl-Qatiah", 3/246-247;

altında olanın məsuliyyətini öz üzərinə götürmək mənası bu kontekstdə geniş yayılmış bir mənadır. Lakin bu mənanı mübarək ayədən açıq şəkildə çıxarmaq çətin ola bilər. Buna görə də, rəvayətlər bu məsələdə gözəl bir yardım rolunu oynayır."[155] Eyni həqiqəti biz əş-Şərif əl-Murtəda'nın arqumentlərində də gördük, çünki ayədən öz məzhəbi üçün dəlil çıxarmaq üçün çoxşaxəli və çoxpilləli müqəddimələrə ehtiyac duydu. Halbuki ayənin zahirində və məzmununda belə bir məna yoxdur. Ona görə də əl-Cahiz deyir: "Lakin sözün zahiri mənası təfsirçilərin, məsələn, İbn Abbas və başqalarının dediyi kimi başa düşülə bilər. Onlar bu ayənin Abdullah bin Səlam və bir qrup müşrik Kitab əhli barəsində nazil olduğunu iddia etmişlər. Belə ki, onlar zöhr vaxtı Peyğəmbərin - salləllahu aleyhi və səlləm - yanına gəlib dedilər: "Ya Rəsulallah! Evlərimiz uzaqdır və bu məsciddən başqa bir məscid tapa bilmirik. Qövmümüz isə Allahı və Onun Rəsulunu təsdiqlədiyimiz üçün bizə düşmən oldular, bizimlə əlaqəni kəsdilər və bizimlə danışmayacaqlarına and içdilər." Onlar qövmünün düşmənçiliyindən şikayət etdikləri bir anda bu ayə nazil oldu: "*Həqiqətən, sizin vəliniz Allah, Onun Rəsulu və rüku halında namaz qılan, zəkat verən möminlərdir.*" Peyğəmbər - salləllahu aleyhi və səlləm - bu ayəni oxuduqda, onlar dedilər: "Biz Allahın, Onun Rəsulunun və möminlərin vəlayətinə razıyıq."[156]

## İtaət ayəsi

Allah – təalə - buyurur: "**Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!**"[4:59] Şiə alimləri bu ayəni dəlil gətirərək deyirlər ki, burada "əmr sahiblərinə" itaət etmək mütləq şəkildə əmr olunduğu üçün və əmr sahibləri ayədə peyğəmbərə atf olunduğu üçün onunla eyni hökmü qazanmış olur; yəni bu əmr sahibləri peyğəmbər kimi mütləq itaətə layiq və onun kimi məsum olmalıdırlar. Misal üçün əl-Vahid əl-Xorasani yazır: "Vəli əl-Əmr (Əmr Sahibi) adına gəldikdə isə,

[155] əl-Qumi, "əl-Viləyə əl-İləhiyyə əl-İsləmiyyə", 1/21; Muəssəsətu ən-Nəşr əl-İsləmi, Qum,
[156] əl-Cahiz, "əl-Usməniyyə", səh: 118;

Uca Allah onun itaətini Peyğəmbərin itaəti ilə yanyana gətirmişdir, belə ki, O buyurur: *'Allaha itaət edin, Peyğəmbərə və sizdən olan əmr sahiblərinə itaət edin!"* Hər iki itaətin vacibliyini tək bir əmr ilə yanaşı tutmaqla sabit olur ki, əmr sahibinin əmri ilə Peyğəmbərin əmri bir-birinin yanında durur. Əgər əmr edən Peyğəmbərin məsumluğu kimi məsum olmasaydı, bu iki əmri müqayisə etmək mümkün olmazdı, çünki batilə əmr edən şəxs haqqı əmr edən şəxs ilə eyni ola bilməz."[157] Həmçinin Şeyxut-Taifə ət-Tusi yazır: "Mütləq şəkildə itaəti vacib görmək məsum, səhvdən və xətadan qorunulmuş kəslərdən başqası üçün mümkün deyildir və belə bir şey nə əmirlərdə, nə də alimlərdə mövcuddur. Bu yalnız dəlillərin məsumluqlarına və paklıqlarına dəlalət etdiyi imamlar barəsində vacibdir."[158]

Sünnət əhlinin alimləri belə bir anlayışın xətalı olduğunu deyirlər. Ayədə möminlərə Allaha, peyğəmbərinə və əmr sahiblərinə itaət etmək əmr olunur və bu ayə nazil olarkən, möminlərə Allahla, peyğəmbərlə yanaşı mütləq şəkildə itaət olunması vacib olan məsum əmr sahibləri mövcud deyildi. Hətta əksər şiə alimləri belə qəbul edirlər ki, onların iddia etdikləri imamlara mütləq şəkildə itaət peyğəmbərin – aleyhissalətu vassələm – vəfatından sonra vacib olub, həmçinin qəbul edirlər ki, eyni zamanda iki imam ola bilməz. Lakin ayədə əmr sahibləri cəm şəklində gəlir və ayənin endiyi ərəfədə mövcud olan əmr sahiblərini öncəliklə nəzərdə tutur. Əgər belə olmasaydı bu, muxatablara heç bir təsiri və faydası olmayan, hələ də mövcud olmayan əmr sahiblərinə itaət etməyi əmr etmiş olardı ki, bu cür mənasızlıqdan Quran münəzzəhdir. Bu nöqtəni anlamaq çətin deyildir. Özümüzü ayənin nazil olduğu zamanda yaşayan müsəlmanların yerinə qoysaq və onların ayədən nə anladıqlarını fərz etsək təbii ki, əmr sahibləri deyildikdə ilk ağla gələn Allahın elçisinin – aleyhissalətu vassələm – təyin etdiyi əmirlər, valilər olacaq. Ona görə də şiə alimlərindən Muhəmməd Asif əl-Muhsini bu nöqtədə sünnət əhli ilə razılaşır ki, ayədə "əmr sahibləri ilə murad" olunan kəslər "Allahın elçisinin hüzurunda və sağlığında...Allahın elçisinin insanları idarə etmək, işləri islah etmək, müharibələrdə ordulara rəhbərlik etmək üçün vəzifə və məqam verdiyi kəslərdir." əl-Muhsini buradan belə nəticə çıxarır ki, "müsəlmanların üzərində hakimiyyəti – istər bu hakimiyyət ümumi olsun, istərsə də xüsusi olsun, istər bütün müsəlmanların üzərində

---

[157] əl-Xorasani, "Muqaddimətun fi Usul əl-Din", səh: 455;

[158] ət-Tusi, "ət-Tibyən", 3/236;

keçərli olsun, istərsə də bir hissəsinin üzərində - şəri olaraq sabit olmuş hər bir kəsə... itaət etmək vacibdir."[159]

Üstəlik ayədə itaət əmrinin mütləq şəkildə gəlməsi məsumluğa dəlalət etmir, çünki buradakı mütləqlik Allahın muradı deyildir və bunun murad olmadığı həm ayənin özündəki ləfzi və əqli qarinalardan, həm də ayədən kənar dəlillərdən anlaşılır. Bu ayədə "itaət" əmri mütləq gəldiyi kimi "əmr sahibləri" sözü də ümumilik ifadə edir. Şiələr itaət əmrinin mütləqliyinə əsaslanaraq "əmr sahibləri" sözünün ümumiliyini xüsusiləşdirirlər, yəni iddia edirlər ki, burada bütün əmr sahibləri qəsd olunmur, lakin xüsusilə məsum imamlar qəsd olunur. Sünnət əhli isə "əmr sahibləri" sözünün ümumiliyini qoruyaraq "itaət" əmrindəki mütləqliyi qeydə bağlayırlar. Əslində burada heç bir ziddiyyət yoxdur, çünki ləfzin ümumiliyi "itaət" əmrindəki mütləqliyin qəsd olunmadığını bəyan etmək üçün kifayət edir. Belə ki, ümumun dəlaləti özlüyündə bir bəyandır və "itaət" əmrinin mütləq şəkildə gəlməyinə əsaslanaraq "əmr sahibləri" sözünün ümumiliyini xüsusiləşdirmək doğru deyildir. Çünki ümumun dəlaləti daha güclüdür. Üsul alimləri deyirlər ki, ümumi hökmü xüsusiləşdirmək (təxsis) ilə mütləq əmri qeydə bağlamaq (yəni təqyid etmək) arasında seçim edilməli olsa "təqyid" öncəlik qazanmalıdır, çünki ümumun dəlaləti özlüyündə bəyandır, o ümuma daxil olan fərdlərin hamısını öz əhatəsinə almaq mənasında zahirdir, amma mütləqə gəldikdə isə o, sadəcə bəyanın əksikliyi deməkdir.[160] Bu nöqtədə hansısa bir ixtilafın olduğunu bilmirəm. Şiələrdə "fəqihlərin və müctəhidlərin ustadı" ləqəbi ilə tanınan Şeyx Murtəda əl-Ənsari yazır: "Bura həmçinin mütləq ilə ümumun təaruzu da aiddir, beləliklə də mütləqin təqyidi ilə ümumun təxsisi qarşı-qarşıya gəlmiş olur. Burada təqyidin önə keçirilməsində heç bir problem yoxdur..., çünki mütləq ilə hökm vermək bəyanın olmadığı yerlərdə edilir, (amma) ümumun özü isə bəyandır..."[161] Bütün bunlar o deməkdir ki, əgər bir dəlildə ümumi mənanı xüsusiləşdirmək ilə mütləq olanı muqayyəd etmək, yəni təqyid etmək arasında seçim edilməlidirsə o zaman təqyidə

---

159 əl-Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/429-430; Muəssəsətul-Arif, Beyrut, 1426/2005

160 Əhlüs-sünnət alimləri içində bu məsələdə Fəxruddin ər-Razi'yə xas bir rəy vardır; beləki o, ayədəki itaət əmrinin mütləqliyi ilə "əmr sahibləri" ləfzinin ümumiliyini birləşdirmişdir. Ayədəki mütləqliyi məsumluğa dəlil olaraq qəbul etdiyi halda ayədəki ümumiliyi də bütün ümmət üçün, daha dəqiq desək ümmətin ictihad əhliyyəti olan alimlərinin hamısı üçün qəbul etmişdir. Bunu müctəhid alimlərinin icmasının məsumluğuna dəlil gətirmişdir. Bax: "Təfsir ər-Razi", 10/113-114;

161 əl-Ənsari, "Fəraidul-Usul", 2/792; Muəssəsətun-Nəşr əl-İsləmi, Qum,

üstünlük verilməli və mütləqi məhdudlaşdırmalıyıq, çünki ümumun dəlaləti daha güclüdür. Eyni mənanı bir başqa şiə alimi Şeyx Muhəmməd Tahir Al əş-Şeyx Radi belə izah edir: "Ümumdakı ümumiliyin zahiri bir başa keçərlidir, mütləqdəki mütləqliyin zahiri isə fərqlidir, çünki o, bəyanın olmamağından asılıdır, ümum isə özlüyündə bəyan olaraq yararlıdır, beləliklə də bu halda ümuma üstünlük verilməlidir, çünki onunla yanaşı mütləqin tələb etdiyi məna tam deyildir..."[162] Başqa cür desək ayədə itaət əmrinin mütləq olmadığını görmək üçün ayənin özündəki ləfzi və əqli qarinalar kifayət edir, amma "əmr sahibləri" sözünün ümumiliyini xüsusiləşdirmək üçün daha güclü kənar dəlillər lazımdır. Ayədə əslində heç bir təaruz yoxdur, çünki "əmr sahibləri" sözünün ümumiliyi "itaət" əmrinin mütləqliyi üçün bəyan olaraq kifayət edir. Burada ümum ilə mütləqlik arasındakı ziddiyyətin tək bir nasda gəlməsi ilə onların iki fərqli nasda gəlməsi arasında fərq yoxdur, hər iki halda da ümum önə keçirilməlidir. Aradakı yeganə fərq budur ki, bitişik gəldikdə biz deyirik ki, mütləq ləfz ilə qeydsizlik, yəni mütləqlik əvvəlcədən qəsd edilmir. Lakin ayrı-ayrı dəlillərdə gəldikdə deyirik ki, ümum varid olana qədər mütləqliyin tələbi keçərlidir, ümum sadəcə olaraq zühur etdikdə mütləqliyin dəlilinə son qoyur. Əbul-Qasim əl-Xoyi'nin bu barədə təqrirlərini yazanlar da bu fərqə diqqət çəkiblər və qeyd ediblər ki, nəticə etibarı ilə bir fərq yoxdur, hər iki halda ümum önə keçirilməlidir: "Əgər iki mətnin biri bir hökmə qeydsiz (mutləq) şəkildə, digəri isə ümumi şəkildə dəlalət edərsə – bu zaman ümumi məna daşıyan dəlalət, qeydsiz (mutləq) dəlalətdən üstün tutulur. Bunun səbəbi budur ki, ümumi ifadənin dəlaləti təncizidir və hansısa bir xarici müqəddiməyə ehtiyac duymur. Halbuki mütləq ifadənin dəlaləti şərtlidir və "hikmət müqəddimələri"nin[163] tamlığına bağlıdır; bu

[162] Radi, "Bidəyətul-Vusul fi Şərh Kifəyətil-Usul", 9/137; Usratu Al əş-Şeyx Radi, 1425

[163] "Hikmət müqəddimələri" termini, İslam fiqhində və xüsusilə üsul elmində mütləq (qeydsiz) ifadələrin necə başa düşülməli olduğunu izah etmək üçün istifadə olunur. Bir söz və ya hökm qeydsiz (mütləq) şəkildə işlədilmişsə, bu hökmü doğrudan da qeydsiz şəkildə başa düşmək üçün bəzi şərtlər mövcuddur. Bu şərtlərə "hikmətin müqəddimələri" və ya "hikmətin qarinaları" deyilir. Şiə fəqihləri bunların əsasən üç müqəddimə olduğunu deyirlər. Birinci müqəddimə budur ki, qanun qoyan və ya danışan şəxs, istifadə etdiyi mütləq ifadəyə heç bir qeyd əlavə etməməlidir və əgər bu ifadəyə aid zəruri bir qeyd var idisə və bunu bildirməyibsə, burada "hikmət" prinsipinə əsasən deyilir ki, o, bu hökmü qeydsiz (mütləq) şəkildə qəsd etmişdir. Bu zaman əlavə qeydin həmin ifadəyə bitişik gəlməsi ilə ayrı gəlməsində fərqi yoxdur. İkinci müqəddimə isə budur ki, bu mütləq ifadə qeydin açıqlanmasının zəruri

müqəddimələrdən biri də ona dair hər hansı bir qeydin (izahın) verilməməsidir. Və çox aydın olduğu kimi, ümumi ifadə mutləq olan üçün bir açıqlama (bəyan) rolunu oynaya bilir, ümumi ifadə ilə birlikdə hikmət müqəddimələri tamamlanmadığı üçün mütləq ilə əməl etmək mümkün olmaz." Bunun arxasınca buyurulur: "Ümumilikdə qeyd etdik ki, hökmün ümumi (ʿamm) və mütləq (muṭlaq) arasında dövr etməsi məsələsi, təaruzun (ziddiyyətin) əsas kateqoriyasına daxil deyil. Çünki fərz edildiyi kimi, isbat mərhələsində (məqāmul-isbāt) bu iki ifadənin məna baxımından bir-biri ilə ziddiyyət təşkil etməsi yoxdur. Örfün onların arasında heç bir təzad görməməsi, əksinə ümumi ifadəni, mutləq ifadəni qeyd etmək (təqyid) üçün uyğun bir qarina (izahedici göstərici) hesab etməsi zəruridir. Bu məsələdə ümumi ifadənin mütləq ifadə ilə birgə (müttəssil) gəlməsi, ya da ayrılıqda (münfəsil) gəlməsində fərq qoyulmaz. Sadəcə fərq bundadır ki: birinci halda bu, mütləqin qeydsizliyə dair zahiri mənasının (iṭlaqın) formalaşmasına mane olur, ikinci halda isə bu, mütləq ifadənin qeydsizliyə dair zahiri mənasının höccət olmasına mane olur."[164] Muhəmməd Surur əl-Bəhsudi isə əl-Xoyi'nin qeyd etdiyi fərqi bu şəkildə zikr edir: " Sadəcə fərq ondadır ki, əgər ümumi ifadə (mütləq ilə) birləşik (müttəsil) gəlirsə, bu zaman mütləq ifadənin qeydsiz mənasının formalaşması başdan əngəllənir. Əgər ümumi ifadə ayrı (münfəsil) gəlirsə, o zaman (ümumi ifadə) mütləq ifadənin qeydsizliyinə iradənin olmadığını sonradan üzə çıxaran kəşfedici bir dəlil olur. Bu qədər fərq isə ümumi ifadənin mütləqə üstün tutulması hökmündə heç bir dəyişiklik yaratmır."[165] Beləliklə də bu üsul prinsiplərinə əsasən deyə bilərik ki, ayədə əslində itaət əmrindəki mütləqlik qəsd olunmur. Ona görə də şiə alimlərindən Muhəmməd Hüseyn Fədlullah yazır: "İtaət əmri hər zaman itaət olunan şəxsin məsumluğunu fərz etmir,

---

olduğu bir məqamda işlədilib, yəni izah edici qeydə ehtiyac olduğu halda bu qeydə yer verilməyib. Yəni qanun qoyan (şari) və ya danışan şəxs elə bir məzmunda danışmalıdır ki, əgər həqiqətən hansısa qeyd vacibdirsə, onun bu qeydi bildirməsi gözlənilirdi. Bu, sözü söyləyənin və ya qanunqoyanın bəyan məqamında danışması, onun niyyətini səmimi və dürüst hesab etmək prinsipinə əsaslanır. Üçüncü müqəddimə isə budur ki, izah edici qeydi açıqlamağa mane olan hal olmamalıdır. Bu isə o deməkdir ki, əgər qanunqoyanın qeyd verməsinə mane olan bir vəziyyət var idisə, bu zaman artıq onun səssizliyi qeydsizliyə dəlalət etməz. Şiə fəqihləri bunun üçün bir imamın təqiyyə etməsini misal verirlər.

[164] İshaq əl-Fəyyad, "Muhadarat fi Usul əl-Fiqh", 3/316-317;

[165] əl-Bəhsudi, "Misbəhul-Usul", 3/377-378;

əksinə ola bilsin ki, onun sözünün hüccət olması üzərində vurğu etmək üçün gəlib..Necəki fəqihlərə müraciət etməyə dəlalət edən xeyli hədisdə hal belədir, halbuki bu fəqihlər şəri hökmü anlamaqda xəta da edə bilərlər, doğruya da isabət edə bilərlər. Burada onlara tabe olmaqdan doğan müsbət nəticələr ilə onlara tabe olmadıqda yarana biləcək mənfi nəticələr arasında müqayisə edilmiş və müsbət nəticələrin mənfi nəticələrə üstünlüyü diqqətə alınmışdır. Buradan çıxış edərək biz, itaət əmrinin "əmr sahibləri" ilə qəsd edilənin məsumlar olmasına dəlil olduğunu deyə bilmərik..."[166]

Burada "əmr sahiblərinin" itaət baxımından "peyğəmbərə" atf edilməsi də məsələnin hökmünü dəyişdirməz. Bunu anlamağın iki yolu vardır. Birinci yol budur ki, əmr sahiblərinin peyğəmbərə atf olunması peyğəmbərin hökmünün və vəsfinin əmr sahiblərində də olmasını gərəkdirməz. Allah – cəllə cələluhu – buyurur: "**De: "İstədiyinizi edin! Allah, Peyğəmbəri və möminlər əməllərinizi görəcəklər. Siz qeybi də, aşkarı da bilən Allahın hüzuruna qaytarılacaqsınız. O, etdiyiniz əməlləri sizə xəbər verəcəkdir.**"[9:105] Şübhəsiz ki, Peyğəmbərin və möminlərin bu şəhadət dünyasında əməlləri görməkləri Allahın görməsi kimi deyildir. Möminlərin və peyğəmbərin görmək felində Allahın adına atf olunmaqları onların eyni hökmdə olmaqlarını gərəkdirməz. Həmçinin "**Allaha və Peyğəmbərə itaət edin ki, bəlkə sizə rəhm olunsun!**" [3:132] deyildikdə peyğəmbərin Allahın adına atf edilməsi onların hökmdə eyni olmaqlarını gərəkdirməz, çünki bilirik ki, Allaha itaət Onun Rəbb olmasına görədir, peyğəmbərə itaət isə onun Allah tərəfindən göndərilmiş olması səbəbilə vacibdir. Ona görə də şiə alimi Muhəmməd Asif əl-Muhsini bu ayədən imamların məsumluğu hökmünün çıxmadığını etiraf edir və deyir: "Bu əmr sahiblərinin vəsflərinin necəliyinə gəldikdə isə bu, başqa dəlillərdən çıxarılmalıdır, bu ayə onu bəyan etmir... Şiə alimlərindən bir qrupun - "Allah əmr sahiblərinə itaəti Allaha və rasuluna itaət kimi mütləq olaraq vacib etmişdir və Allahın məsum olmayan, xəta etməkdən salamat olmayan birinə mütləq itaəti vacib etməsi mümkün deyildir..." şəklində dediklərinə gəldikdə isə əmr sahiblərini yalnız məsumlara məhsur etməkləri qənaətbəxş deyildir, çünki hakimə, qaziyə itaət etmək, zənni əmirlərə itaət etmək, etibarlı müəzzinə, camaat namazında imama və bənzərlərinə, xəta etmələri ehtimalı olduğu halda onların zahirləri ilə

[166] Fədlullah, "Təfsir min Vəhy əl-Quran", 7/325; Darul-Mələk, Beyrut, 1419;

kifayətlənərək itaət etmək icazəlidir. Amma əmr sahiblərinin günah etməklərini və günah etməyi əmr etməklərini fərz etməyə gəldikdə isə bu, onlara itaətin vacibliyindən xüsusi dəlil ilə istisna olunur və bu şəkildə dəlillər cəm edilir. Buna görə də Allahın elçisinin – salləllahu aleyhi va əlihi va səlləm – və möminlərin əmirinin – aleyhissələm – vəzifə, rəhbərlik və hansısa işdə vilayət verdikləri şəxslər məsum deyildilər və hətta günahda belə onlara itaət etmək o dövrün ağıl sahiblərinin ağıllarına gəlmirdi."[167] Gördüyümüz kimi əl-Muhsini etiraf edir ki, ayənin özündə məsumluğa dair heç bir məna yoxdur. əl-Muhsini ümumiyyətlə ayədən bu mənanın anlaşılmadığını, risalət dövründə heç kimin ayədən belə bir məna anlamadığını deyir. Onun sözündən başa düşülür ki, əgər ayənin zahirindən "məsumluq" etiqadı anlaşılmış olsaydı o zaman o dövrdə Allahın elçisinin - salləllahu aleyhi va əlihi va səlləm - təyin etdiyi əmirlərin, valilərin məsum olduqlarına etiqad edərdilər, çünki ayə nazil olarkən "sizdən olan əmr sahibləri" sözünə daxil olmağa layiq olan şəxslər peyğəmbərin təyin etdiyi əmr sahibləri idi. Mirzə Cavad ət-Təbrizi də məsum imamların təyin etdikləri valilərə və hakimlərə "şəriətdə sabit olmuş əhkam ölçülərinə müxalif olmadığı müddətdə" itaət etməyin vacib olduğundan danışarkən deyir: "İmamlar - aleyhimussələm - tərəfindən təyin olunmuş kəslər də mübarək ayədəki "əmr sahibləri" ünvanına daxildir; (ayədəki) "əmr sahibləri" sözü ilə qəsd olunanın imamlar - aleyhimussələm - olmasına dair bu ayənin təfsirində keçən izahlara gəldikdə isə arada heç bir ziddiyyət yoxdur, çünki Allahın elçisinin - salləllahu aleyhi va əlihi - və İmamın - aleyhissələm - təyin etdiklərinə itaət peyğəmbərin və imamın özünə itaətdir."[168]Aydın məsələdir ki, əhlüs-sünnət də razılaşır ki, Peyğəmbərin - aleyhissalətu vassələm - təyin etdiyi valilər, qazilər, ordu başçıları da ayədəki "əmr sahibləri" ünvanına daxildir, çünki onlara itaət əslində peyğəmbərə itaətdir. Allahın elçisi - aleyhissalətu vassələm - buyurur ki, "kim mənim əmirimə itaət edərsə mənə itaət etmişdir, kim mənim əmirimə asi olarsa mənə asi olmuşdur."[169] Eyni şəkildə Allahın qoyduğu qaydalar və şərtlər əsasında müsəlmanların başlarına seçdikləri xəlifələrə şəriət çərçivəsində itaət də ayəyə daxildir, çünki onlara itaət Allahın şəriətinə itaətdir və Allahın şəriətinə itaət Allaha itaət deməkdir. Əgər ayədə itaət əmrindəki mütləqlik itaət olunan

---

[167] əl-Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/429-430; Muəssəsətul-Arif, Beyrut, 1426/2005

[168] ət-Təbrizi, "İrşədut-Talib ilət-Təliq aləl-Məkəsib", 3/28; Darus-Siddiqa əş-Şəhidə

[169] əl-Buxari, 6718, Muslim, 1835

şəxslərin məsumluğuna dəlalət etmiş olsaydı o zaman Mirzə Cavad ət-Təbrizinin izahı doğru olmazdı. Çox maraqlıdır ki, bu ayənin imamlara və onların məsumluğuna heç bir şəkildə dəlalət etmədiyini etiraf edən şiə alimlərinin başında Aləmul-Hudə[170] ləqəbi ilə tanınmış Əbul-Qasim Əli bin əl-Hüseyn əl-Murtəda (355/965 - 436/1044) gəlir. O deyir: "Kitabın müəllifi (yəni əl-Qadi Abdulcabbar) dedi: "Onların daha bir dəlili budur: onlardan biri Allah-Təalanın "**Ey iman gətirənlər! Allaha itaət edin, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!**" [4:59] sözlərini dəlil gətirib və qeyd edib ki, Allahın onlara itaəti vacib etməsi yalnız və yalnız onların təyin olunmuş şəxslər, xəta etmələri qeyri-mümkün olan məsumlar olması halında mümkündür. Bunun təsdiqi tələb edir ki, həmin şəxs möminlərin əmiri (Əli) - aleyhissələm - olmalıdır, çünki dediklərimizdən başqa bir izah yoxdur. Sonra o, bu metodun yanlışlığını izah etməyə və onun batil olması haqqında danışmağa başladı."[171] əş-Şərif əl-Murtəda burada müxalifi əl-Qadi Abdulcabbar'ın sözlərini verdikdən sonra ona belə cavab verərək deyir: "Biz isə deyirik: Bu ayə möminlərin əmirinin təyin olunmuş olmasına dəlalət etmir və alimlərimizdən heç kimin bu məqsədlə bu ayəyə əsaslandığını bilmirik. Bu ayəni bir tək İbn ər-Ravəndi "əl-*İmamə*" kitabında İmamların məsum və adları ilə təyin olunmuş olmaqlarının gərəkdiyinə dəlil olaraq göstərmişdir. Lakin ayə bu mənanı da ifadə etmir. Tələb olunan mənaya dəlalət eməyən "sübutları" çoxaltmaq mənasızdır, çünki Allahın lütfü və neməti ilə, hüccətin sübutu üçün mövcud olan dəlillər kifayət qədərdir. Üstəlik əgər İbn ər-Ravəndi'nin gətirdiyi arqumentə və kitabın müəllifi (əl-Qadi Abdulcəbbar)ın sözünün əvvəlində dediyinə əsasən - ayə imamların məsumluğunun və adları ilə təyin olunmasının zəruriliyinə dəlalət etmiş olsaydı belə, yenə də möminlərin əmiri (Əli)nin - aleyhissələm - imam olaraq təyin olunmuş olmasına dəlil olmazdı."[172] Bu sözlər çox önəmli sözlərdir, çünki əş-Şərif əl-Murtəda burada etiraf edir ki, ayə imamların məsumluğu, onların Allah tərəfindən təyin olunmaqlarının zərurəti kimi ümumi imamətlə bağlı məsələlərə dəlalət etmədiyi kimi, həmin imamın məhz Əli bin Əbi Talib - radiyallahu anhu - olmasına da, yəni xüsusi

---

[170] Bu təmtəraqlı ləqəb "hidayət rəhbəri", "doğru yol göstərən sancaq" mənalarını ifadə edir.

[171] Onun bu sözlərini tam oxumaq üçün bax: əl-Qadi Abdulcəbbar, "əl-Muğni", 20/142-143;

[172] əş-Şərif əl-Murtəda, "əş-Şafi fil-İmamə", 2/257-258; Seyyid Abduzzəhra əl-Hüseyni əl-Xatib'in təhqiqi ilə çap olunmuş bu versiyada bəzi xətalar olduğu üçün biz Muhəmməd Hüseyn əd-Dərayəti'nin təhqiqi ilə, hicri 1441-ci ildə Məşhəd şəhərində "Məcmə əl-Buhus əl-İsləmiyyə" tərəfindən çap olunmuş versiyanı əsas aldıq. Bax: 3/131-132;

imamətə də dəlalət etmir. Üstəlik vurğulayır ki, İbn ər-Ravəndi'dən başqa hansısa şiə aliminin bu ayəni tələb olunan mənalar üçün dəlil gətirdiyini görməyib.

Burada "əmr sahibləri" ilə muradın şiələrin etiqadındakı məsum imamlar olmamasının ən böyük və ən aşkar dəlili ayənin özündədir. Beləki şiələr dəlil olaraq gətirdikləri ayəni yarımçıq gətirirlər, ayənin davamında Allah – cəllə cələluhu – buyurur: "**Əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə ərz edin! Bu həm daha xeyirli, həm də nəticə etibarilə daha gözəldir.**" Ayənin bu hissəsi şiələrin iddiasını iki tərəfdən rədd edir. Bunlardan birincisi ixtilaf məqamında möminlərə verilən göstərişlə bağlıdır. Şiələrin iddiası budur ki, peyğəmbərdən sonra Quranı bəyan etmək, ixtilaf edilən məsələlərdə hökm vermək üçün imamların olması zəruridir və labüddür və bu missiyanı onlar yalnız məsum olduqları halda edə bilərlər. Əgər bu iddia doğru olsaydı o zaman Allah – cəllə cələluhu – bu ayədə ixtilaf etdiyimiz təqdirdə bizi imamlara yönləndirməsi lazım idi. Lakin ayə ixtilaf məqamında imamlara yox, Qurana və peyğəmbərin sünnətinə qayıtmağı əmr edir. Əgər imamlar ixtilaf məqamında əsas referens olsaydılar, Quranın mücməlini təfsil etmək, mütəşabihinə aydınlıq gətirmək, susduğu məqamlarda cavab vermək, qaranlıq qalan məqamları işıqlandırmaq onların vəzifəsi olsaydı Quran bunu əks etdirərdi, belə bir şeyin olmaması, əksinə imamların bu məqamda ehmal edilməsi yalnız və yalnız ona dəlalət edir ki, şiələrin imamət inancı bu ayədə nəzərdə tutulmur, əksinə bu ayədə belə bir inanc ləğv olunur. Əbu Bəkr əl-Cəssas deyir: "Burada imamın nəzərdə tutulması mümkün deyil, çünki Allah bu ayədə belə buyurmuşdur: "Əgər bir şey barəsində ixtilaf etsəniz, onu Allaha və Rəsula qaytarın." Əgər itaəti vacib olan, bir imam olsaydı, mübahisəli məsələlərin ona qaytarılması vacib olardı və o, ixtilafları həll edərdi. Lakin Allah mübahisəli məsələlərin imama deyil, Kitaba və Sünnəyə qaytarılmasını əmr etdiyi üçün bu, onların imamət barədə dediklərinin batil olduğuna dəlalət edir. Əgər itaəti vacib olan bir imam olsaydı, Allah: "Onu imama qaytarın!" deyə buyurardı, çünki onların inancına görə, imam Kitabın və Sünnənin təfsirində qəti hökm sahibidir. Lakin Allah səfərbərlikdə olan ordu əmirlərinə və fəqihlərə itaət etməyi əmr etmiş, mübahisəli məsələlərin həllini isə imama deyil, Kitaba və Sünnəyə qaytarmağı vacib bilmişdir. Bu isə sübut edir ki, imam mübahisəli hökmlərdə itaəti vacib bir şəxs deyil və hər bir fəqih ixtilaflı məsələləri Kitab və Sünnədə olan

nümunələr əsasında həll edə bilər."[173] Bu gün sünnət əhli ixtilaf məqamında bu ixtilafı həll etmək üçün Qurana və peyğəmbərin sünnətinə əsaslanmağı həll yolu kimi görürlər, şiələr isə imamlara nisbət etdikləri xəbərlərə əsaslanmağı doğru hesab edirlər. Ayə çox açıq şəkildə sünnət əhlinin yolunu dəstəkləyir. İlk şiələr bu ayənin onlar üçün problem olduğunu görürdülər və buna görə də kitablarında bu problemi həll etmək üçün bəzi rəvayətlərə yer veriblər. əl-Kuleyni "Usul əl-Kəfi" kitabında rəvayət edir: "əl-Hüseyn bin Muhəmməd – Muallə bin Muhəmməd'dən, o da əl-Həsən bin Əli əl-Vaşşə'dən, o da Əhməd bin Aiz'dən, o isə İbn Uzeynə'dən, o da Bureyd əl-İcli'dən: dedi: "Əbu Cəfər'dən – aleyhissələm – Allahın – azzə va cəllə - bu ayəsi haqqında soruşdum: "Allah sizə əmanətləri sahiblərinə (işi əhlinə) verməyinizi və insanlar arasında hökm verdiyiniz zaman ədalətlə hökm verməyinizi əmr edir." [4:58] Dedi: "Məhz bizi qəsd edir ki, birinci imam özündən sonrakı imama kitabları, elmi və silahı versin. "İnsanlar arasında hökm verdiyiniz zaman ədalətlə" – yəni əlinizdəkilər ilə - "hökm verməyinizi əmr edir." Sonra (Allah) insanlara deyir: "Ey iman gətirənlər! Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin!" Xüsusilə bizi qəsd edir; qiyamətə qədər olan bütün möminlərə bizə itaət etməyi əmr edir. "Əgər bir iş barəsində mübahisə etməkdən qorxsanız onu Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə ərz edin!" Bu şəkildə nazil olub, (yoxsa) Allah necə ola bilər ki, əmr sahiblərinə itaət etməyi əmr etsin və onlarla mübahisə etməyə icazə versin! Bu sözlər "Allaha, Peyğəmbərə və özünüzdən sonra əmr sahiblərinə itaət edin" ayəsi ilə muxatab olanlara deyilib."[174] İmam Əbu Cəfərə nisbət edilən bu rəvayətin zahirindən anlaşılır ki, guya Quranda təhrifə yol verilib və əslində ayə belə nazil olub: "Əgər bir iş barəsində mübahisə etməkdən qorxsanız onu Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə ərz edin!" əl-Məclisi deyir: "Onun "özünüzdən olan əmr sahiblərinə" sözünün zahiri budur ki, bu ayə onlardakı – aleyhimussələm – Quranda bu şəkildə olub, Osman bunu (mushafdan) çıxarıb, çünki (Əbu Cəfər bu rəvayətdə) "bu şəkildə nazil olub" deyir…"[175] əl-Məclisi daha sonra ikinci ehtimal olaraq bunun təfsir mənasında da başa düşülə biləcəyini deyir. Həmçinin digər şiə alimi Muhəmməd Saleh əl-Məzəndərani də bu sözlərin şərhində etiraf edir ki, sözlərin zahiri bu ayədə təhrifin baş

---

[173] əl-Cəssas, "Əhkəmul-Quran", 3/178; Qamhəvi çapı

[174] əl-Kuleyni, "əl-Kəfi", 1/165; Mənşurat əl-Fəcr, Beyrut, 1428

[175] əl-Məclisi, "Mirətul-Uqul Şərh Əxbər Al ər-Rasul", 3/181;

verdiyinə dəlalət edir.[176] Bu zahiri dəstəkləyən bir başqa rəvayəti əl-Kuleyni "ər-Ravda" kitabında rəvayət edir: "Əli bin İbrahim – atasından, o da İbn Əbi Umeyr'dən, o isə Ömər bin Uzeynə'dən, o da Bureyd bin Muaviyə'dən; dedi: "Əbu Cəfər tilavət etdi: "Allaha itaət edin və Peyğəmbərə, özünüzdən olan əmr sahiblərinə itaət edin! Əgər bu işdə bir mübahisənin baş verməsindən qorxsanız onu Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə ərz edin!" Sonra dedi: "Yoxsa necə ola bilər ki, onlara itaət etməyi əmr etdikdən sonra onlarla mübahisə etməyə icazə versin?!..."[177] Həmçinin "Təfsir əl-Qumi" kitabında gəlir: "Atam mənə Həmməd'dən, o da Həriz'dən, o isə Əbu Abdilləh'dən belə dediyini rəvayət etdi: "Bu cür nazil olub: "Əgər bir iş barəsində mübahisə etsəniz onu Allaha, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə ərz edin!"[178] Bu kimi rəvayətlərin şiə kitablarında ortaya çıxması bir daha isbat edir ki, ayədəki bu məqamın problem olduğunu özləri də dərk edirdilər. Əks təqdirdə bu cür rəvayətlərə və suallara ehtiyac olmazdı. Ona görə də Quranda səhabələrin təhrif etdikləri ayələr arasında bunu da misal veriblər. əl-Məclisi yazır ki, "çox sayda xəbərin zahiri onu göstərir ki, (əgər bir iş barəsində mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, onu Allaha və Peyğəmbərə ...) ayəsinin bu yerində "və sizdən olan əmr sahiblərinə" (ərz edin) sözləri sabit idi, lakin ordan çıxarılıb."[179] Bu, Quranda imamət inancı ilə uyğun gəlməyin ayələrdəki problemi həll etməyin ən asan yollarından biridir; əgər problemi konkret dəlillərlə isbat edə bilmirsənsə səhabələri Quranı təhrif etməklə ittiham etmək olar. Biz bunun misalını digər ayələrdə də görmüşük.

Buradakı ikinci məqam isə budur ki, ayədə ümumən Allaha, Peyğəmbərə və əmr sahiblərinə itaət etmək əmr olunduqdan sonra, ixtilaf halı xüsusiləşdirilir. Bu ixtilaf halında Allah möminlərə mübahisə etdikləri məsələni Allaha və Peyğəmbərə ərz etməklərini əmr edir. Burada Allah – subhənəhu - "əmr sahiblərini" möminlərdən ayırmır və ayənin zahirindən başa düşülür ki, burada mübahisə edən tərəfə əmr sahibləri də daxildir. Çünki əmr sahibləri ayənin əvvəlində "minkum" nisbəti ilə xitab olunan tərəfə aid edilib, yəni "sizin özünüzdən olan əmr sahibləri" olaraq qeyd olunublar, ona görə də ayənin ikinci hissəsində onların nə muxatablara, nə də ərz olunan tərəfə aid olmamaqları

---

[176] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 6/85; Dar İhyə ət-Turas əl-Arabi, Beyrut, 1429

[177] əl-Kuleyni, "əl-Kəfi", 8/105;

[178] əl-Qumi, "Təfsir əl-Qumi", 1/207; Muəssəsətul-İmam əl-Mehdi, Qum, 1435;

[179] əl-Məclisi, "Mirətul-Uqul", 26/77;

məntiqsiz olardı. Ərz olunan tərəfdə yalnız Allah və Peyğəmbər zikr olunduğu üçün, əmr sahiblərinə yer verilmədiyi üçün onların da muxatabların arasında olması lazımdır. Ayədən açıq şəkildə anlaşılır ki, əmr sahibləri möminlərə aid edilir və onların içinə qatılır. Ona görə də Məsləmə bin Abdilməlik Mədinə şəhərinin fəqihlərindən olan Əbu Həzim'ə "Məgər sizə "əmr sahiblərinə" sözü ilə bizə itaət etmək əmr olunmayıbmı?" dedikdə Əbu Həzim cavabında buyurdu: "Bəs məgər siz haqqa müxalif olduğunuzda Allah "əgər bir iş barəsində mübahisə etsəniz onu Allaha və Peyğəmbərə ərz edin" deyərək sizdən bunu almadımı?!"[180] Əbu Həzim burada tabiin nəslimdən olan Sələmə bin Dinar əl-Məxzumi'dir, əmirlərə və sultanlara dili ilə öyüd-nəsihət etməyi ilə tanınıb.

Bu dediklərimizi təsdiqləyən ən önəmli tərəflərdən biri də budur ki, şiə alimləri özləri dövlət başçılarına itaətin vacib olduğunu göstərmək üçün bu ayəni dəlil gətirirlər. Şiə alimlərindən Muhəmməd Baqir əs-Sadr müasir iqtisadiyyatdan və İslam şəriətinin toxunmadığı boşluqlardan danışarkən əmr sahiblərinin bu boşluqları doldura biləcəklərini vurğulayır. Buyurur: "Bu boşluqları doldurmaq üçün belə səlahiyyətlərin əmr sahibinə verilməsinin dəlili müqəddəs Quranın sözləridir: "Ey iman edənlər, Allaha itaət edin, Peyğəmbərə və sizdən olan əmr sahiblərinə itaət edin!" Əmr sahiblərinin səlahiyyətlərinin əhatə etdiyi bu boşluqların ölçüsü, bu mübarək ayənin işığında bütün mübah felləri öz içinə alır; beləliklə də haramlığına və ya vacibliyinə dair şəri bir nassın varid olmadığı bütün fəaliyyətlərdə və əməllərdə, əmr sahibinin onlara ikinci bir hökm vermək səlahiyyəti vardır, ya onları qadağan edə bilər, ya da əmr edə bilər..."[181] Əgər ayədə "əmr sahibləri" ilə murad məsum imamlardırsa o zaman bu ayənin belə bir məqamda dəlil gətirilməsi doğru deyildir. Eyni şəkildə bu ayənin şiələrdəki fəqihin vilayəti məsələsində dəlil gətirənlər də dolayısıyla sünnət əhlinin təfsiri ilə razılaşmış olurlar. ən-Nəcəfi əl-Cəvahiri yazır ki, "(Fəqihin) hakimliyi barəsindəki dəlillərin mütləqliyi... onu (yəni fəqihi) itaət etməyi Allahın bizə vacib etdiyi "əmr sahiblərindən"

[180] əz-Zəməxşəri, "əl-Kəşşəf", 1/524;

[181] əs-Sadr, "İqtisadunə", səh: 725-726; Darut-Təaruf, Beyrut, 1401;

edir."[182] Abdulalə əs-Səbzəvari onun bu sözləri ilə razılaşır və bunun gözəl bir söz olduğunu deyir.[183]

Biz "Nəhcul-Bələğə" kitabına nəzər yetirdiyimizdə görürük ki, Əli bin Əbi Talibə nisbət edilən məktublarda da bizim göstərməyə çalışdığımız məna öz əksini tapır. Beləki Əli – kərramallahu vachəhu – Misirə vali olaraq təyin etdiyi Malik əl-Əştərə yazdığı əhdində ona bu nəsihəti edir: "Sənə çətin gələn halları, qaranlıq qalan məsələləri Allaha və Peyğəmbərə ərz et, çünki Allah irşad etmək istədiyi bir qövmə buyurmuşdur: "Ey iman edənlər, Allaha itaət edin, Peyğəmbərə və özünüzdən olan əmr sahiblərinə itaət edin. Əgər bir şeydə mübahisə etsəniz onu Allaha və Peyğəmbərə ərz edin!" Allaha ərz etmək Kitabındakı möhkəm ayələrlə əməl etməkdir, Peyğəmbərə ərz etmək isə onun – üzərində ixtilaf edilmiş yox, icma edilmiş – sünnətinə ərz etməkdir."[184] Əgər şiələrin bu ayədən anladıqları məna doğru olsaydı Əlinin öz valisinə yazdığı bu nəsihət xətalı olmalıdır, çünki əgər Əli məsum imamdırsa o zaman ixtilaflı məsələlərdə Qurana və sünnətə qayıtmaq əvəzinə birbaşa Əlinin özündən soruşmaq daha məntiqli olardı. Malik əl-Əştərə yazdığı bu uzun nəsihətin heç bir yerində məsum imamlardan, onlara itaətin vacibliyindən söz açılmır. Əhəmiyyətli bir vəzifəyə təyin etdiyin şəxsə bu qədər önəmli və dəyərli məlumatı verməyi unutmağın qəribə deyilmi?! Həmçinin Əli bin Əbi Talibə nisbət edilən başqa sözlərdə xaricilərin dəlillərini rədd edərkən deyir: "İnsanların başında saleh və ya facir bir əmirin olması labüddür ki, onun əmirliyində mömin çalışsın, kafir öz nəsibini alsın, Allah onun vasitəsilə əcəli çatdırsın, onunla qənimətlər toplansın, düşmənə qarşı vuruşulsun, yollarda əmin-amanlıq olsun."[185]

Bu ayə ilə bağlı yazdıqlarımızın sonunda müasir şiə alimlərindən Kamal əl-Heydəri'nin bir etirafına yer vermək yerinə düşür. əl-Heydəri deyir: "Deməli bura qədər dediklərimizdən hasil olur ki, birinci yanaşmaya görə bu ayədəki itaət mütləqdir, peyğəmbərin və əmr sahiblərinin məsumluğuna dəlalət edir. Bu, birinci yanaşmadır və buradan çıxış edərək (ayədəki) əmr sahibləri (ünvanı)nın yalnız məsum (imam)lara xas olduğunu deyiblər. İkinci yanaşma isə deyir ki, xeyr, bu

---

[182] əl-Cəvahiri, "Cəvahir əl-Kələm fi Şərh Şərai əl-İsləm", 16/73; Muəssəsətu ən-Nəşr əl-İsləmi, Qum, 1430

[183] əs-Səbzəvari, "Muhəzzəb əl-Əhkəm", 16/367

[184] "Nəhcul-Bələğə", 3/93-94;

[185] "Nəhcul-Bələğa", 1/91;

cür dəlilləndirmədə iki mülahizə vardır. Birinci mülahizə (budur ki,) hətta (ayədəki) itaət (əmri) mütləq olsa da məsumluğu gərəkdirməz. İkinci mülahizə isə budur ki, bu mütləq itaətin qeydə bağlanması labüddür; ya başqa ayələr ilə, ya da ayənin özündəki əqli qarinalar ilə. Beləliklə biz özümüz hansını seçirik? Cavab budur ki, mənə görə aydındır ki, mənim seçimim əvvəlki kitablarımda yazdıqlarımdan fərqli olaraq (indi) ikinci yanaşmadır. Əvvəl yazdığımız kitablarda biz bu ayəni məsumluğa, yəni imamət müzakirəsində dəlil olaraq gətirmişik. Siz o kitablara müraciət etsəniz görərsiz ki, bu ayəni əmr sahiblərinin məsumluğuna dəlil olaraq gətirmişik. Cavab budur ki, bəli, biz o vaxtı bunu dəlil gətirirdik, amma indi xeyr. Bu o mənaya gəlmir ki, biz (imamların) məsum olmadıqlarını deyirik. Xeyr, (sadəcə olaraq deyirik ki, konkret) bu ayə məsumluğa dəlalət etmir. Ola bilsin ki, bizdə məsumluğa dəlalət edən başqa ayələr və ya peyğəmbərdən əhlul-beyt imamlarının məsumluğuna dəlalət edən qəti rəvayətlər vardır. (Lakin) indi biz, bu ayəni araşdırıb öyrənirik. Əqidəmizə görə bu ayədə nəinki əmr sahiblərinin, heç peyğəmbərin məsumluğuna dair dəlalət yoxdur…”[186]

## Xilafət ayəsi

Allah - təbərakə va təalə - buyurur: “**Sənin Rəbbin mələklərə: “Mən yer üzündə bir canişin (xəlifə) bərqərar edəcəyəm!”– dedikdə, onlar: “Biz Səni həmd-səna ilə təriflədiyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada fəsad törədib qan salacaq bir kəsmi yerləşdirəcəksən?”– söylədilər. O dedi: “Şübhəsiz ki, Mən sizin bilmədiklərinizi bilirəm!”Sənin Rəbbin mələklərə: “Mən yer üzündə bir canişin bərqərar edəcəyəm!”– dedikdə, onlar: “Biz Səni həmd-səna ilə təriflədiyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada fəsad törədib qan salacaq bir kəsmi yerləşdirəcəksən?”– söylədilər. O dedi: “Şübhəsiz ki, Mən sizin bilmədiklərinizi**

[186] əs-Sunnə ən-Nəbəviyyə: Məvqiuhə, Hucciyyətuə, Əqsəmuhə", 50-ci dərs

**bilirəm!**” [2:30] Şiə alimləri bu ayəni əvvəlki iki ayə qədər güclü dəlil hesab etməsələr də yenə müzakirələr əsasında istinad edilən dəlillərdən biridir. Bu ayə əsasən iki məqamda dəlil olaraq gətirilir. Birinci məqam budur ki, imamət məqamına təyinatı yalnız Allah edə bilər. İkinci məqam isə budur ki, imamətin təyinatı davamlı olmalıdır, çünki ayədəki “bərqərar edəcəyəm” və ya “təyin edəcəyəm” mənasına gələn “cəil” kəliməsi ismu faildir və ismu fail davamiyyətə dəlalət edir.

Hər şeydən əvvəl qeyd etməyimiz lazımdır ki, ayədə keçən xəlifə sözünün imama dəlaləti sabit deyildir, çünki xəlifə kəliməsi Quranda fərqli mənalarda gəlib. Misal üçün bir ayədə Allah - cəllə cəlaluhu - buyurur: “(Şərik qoşduqları daha xeyirlidir,) yoxsa darda qalan biri dua etdiyi zaman duasını qəbul edib sıxıntısını aradan qaldıran və sizi yer üzünün varisləri (xuləfə) edən?! Allahla yanaşı başqa bir ilah varmı?! Nə qədər də az düşünürsünüz!” [27: 62] Şiə təfsir alimlərindən ət-Tabrasi bu ayədəki xəlifələr sözünün təfsirində yazır: ”Sizdən hər bir nəsil özündən əvvəlki nəsli əvəz edir, belə ki, bir nəsil məhv olur, və digər bir nəsil yetişdirilir. Başqa bir izaha görə, bu o deməkdir ki, Allah sizi kafirlərin xəlifələri edir, onların torpaqlarında məskunlaşaraq, onların şirk və inadkarlığından sonra Allaha itaət edirsiniz.”[187] Gördüyümüz kimi ət-Tabrasi ayədəki xəlifə sözünü birdən çox mənada təfsir etmişdir və bunlardan heç birində imam mənası qəsd olunmamışdır. Xəlifə sözünə verdiyi ilk təfsir bəşər övladlarından bir nəslin digərini əvəz etməsi, digərinin yerinə keçməsi faktına əsaslanır. Həmçinin bir başqa ayədə Allah - subhənəhu va təalə - buyurur: ”Sizi yer üzünün varisləri (xələif) edən Odur. Kim inkar edərsə, inkar etməsi onun öz əleyhinədir. Kafirlərin inkar etməsi Rəbbi yanında yalnız qəzəbi artırar. Kafirlərin inkar etmələri onların ancaq ziyanını artırar.” (Fatir, 39) Şeyx ət-Tusi deyir: “Allah-Təala (burada) xəbər verir ki, yaratdığı məxluqları yer üzündə xəlifələr edən Odur. Bu o deməkdir ki, hər nəsil özündən əvvəlki nəsli əvəz edir, belə ki, bir nəsil qurtardıqda arxasınca nizamlı və davamlı şəkildə başqa nəsil gəlir. Bu, bunu bu şəkildə icra edən bir tədbir sahibinin olduğuna dəlalət edir… (Ayədəki) "*xələif*" sözünün tək forması "xəlifə"dir, "*səhifə*" və "*səhaif*", "*səfinə*" (gəmi) və "*səfain*", "*vəsifə*" (azyaşlı qız) və "*vəsayif*" kimi. Bu, Əl-Həsən və Əs-Süddinin fikridir. Bəzi alimlər deyiblər ki, bunun mənası, onları Adəmdən əvvəl yaşamış cinlərin xəlifələri etməsidir. Başqaları isə bu ifadənin Peyğəmbərimizin - salləllahu aleyhi va əlihi - ümmətinə aid olduğunu

---

[187] ət-Tabrasi, “Təfsir Məcmə əl-Bəyən”, 7/396;

və Allahın onları digər ümmətlərin xəlifələri etdiyini söyləmişlər."[188] Beləliklə də şiə alimlərinin verdikləri təfsirlərin özündən anlamaq mümkündür ki, xəlifə sözünün Quranda birdən çox mənaya dəlalət etməsi mümkündür. Bu ayədə də Allahın Adəmi yer üzündə xəlifə təyin etməsini bu şəkildə anlamış təfsir alimləri mövcuddur. Adəmin belindən gələcək nəsilləri Yer üzünün xəlifələri olacaqlar, yəni bir nəsil özündən əvvəlki nəslin xəlifəsi olacaq.

Əlbəttə ki, bu ayədə xəlifə sözünün həm də Allahı Yer üzündə təmsil edən mənasında da təfsir edənlər olub və Azərbaycan dilində bunu "canişin" olaraq tərcümə edənlər də bu təfsiri doğru hesab edirlər. O zaman buradakı canişinlik vəsfi Adəmin simasında bütün bəşəriyyətə aid bir vəsf sayılmalıdır, yəni "xəlifə" sözü ilə qəsd olunan təkcə Adəmin özü yox, onunla birlikdə bütün bəşəriyyət qəsd olunur. Şiə təfsir alimi ət-Tabətabəi bu mənanı doğrulayaraq yazır: "Beləliklə, xəlifəlik yalnız Adəmin - aleyhissələm - şəxsi ilə məhdudlaşmır, onun övladları da bu xəlifəliyə heç bir xüsusi məhdudiyyət olmadan ortaqdırlar. 'Adları öyrətmək' ifadəsinin mənası, bu elmin insana elə bir şəkildə yerləşdirilməsidir ki, onun izləri daim tədricən ortaya çıxmaqdadır. Əgər insan doğru yola yönəlsə, bu elmi potensialdan reallığa çevirə bilər. Xəlifəliyin (bu ayədə bütün bəşəriyyət üçün) ümumi gəldiyini təsdiqləyən digər Quran ayələri bunlardır: "Sizi Nuh qövmündən sonra yer üzünün xəlifələri etdik" [7:69] Yenə buyurur: "Sonra sizi yer üzündə xəlifələr etdik" [10:14] və 'sizi yer üzünün vərisləri edən (kimdir)?" [27:62] ət-Tabətabəi'nin anladığı mənanı digər ayələrin təsdiqləməsindən ziyadə həm də mələklərin də sualı təsdiqləmiş olur. Çünki mələklər də ayədən göründüyü kimi Allahın sözündən bu mənanı başa düşüblər. Məhz bu mənanı başa düşdükləri üçün belə soruşurlar: "Biz Səni həmd-səna ilə tərifədiyimiz və Səni müqəddəs tutduğumuz halda, Sən orada fəsad törədib qan salacaq bir kəsmi yerləşdirəcəksən?" Burada mələklər Allahın insan yaradacağını, yəni şəhvətlərinə tabe olub xəta etmək potensialına malik olan xüsusi bir varlıq yaradacağını anladıqları üçün bu sualı verirlər. Onlar bu dediklərində xəta etmirlər, Allahın dediyindən anladıqları mənada həqiqətdən uzaqlaşmırlar, lakin Allahın yaradılış qayəsindən qafildirlər. Bizimlə debat edən Qurban Mirzəxanlı bu nöqtədə öz dəlilini ayaqda tuta bilmək xatirinə mələkləri cahil olmaqda, Allahın xitabını tamamilə səhv başa düşməkdə ittiham edir. Lakin xoşbəxtlikdən şiə təfsir alimləri

[188] ət-Tusi, "ət-Tibyən", 4/338;

onunla razılaşmırlar. Müasir şiə müfəssirlərindən Nasir Məkarim Şirazi yazır: "Mələklər həqiqətlərdən bir həqiqəti bəyan etdilər, ona görə də Allah onların sözlərini inkar etmədi, sadəcə olaraq işarə etdi ki, bu həqiqətlə yanaşı başqa həqiqətlər də, mövcudiyyətdə insanın məkanı ilə bağlı həqiqətlər də var və bu, mələklərin bilmədiyi nöqtə idi."[189] Həmçinin Muhəmməd Hüseyn ət-Tabətabəi yazır: "Allah – subhənəhu – Yer üzünün xəlifəsindən fəsadı və qan axıtmanı inkar etmədi və mələkləri təsbih və təqdis iddiasında yalanlamadı, (əksinə) onları iddia etdiklərində təsdiqlədi. Sadəcə olaraq onlara əlavə bir şey öyrətdi…"[190] Beləliklə də əgər ayədə "xəlifə" sözü ilə insanların bütövlükdə Yer üzünün canişinləri və ya varisləri olaraq təyin olunması qəsd olunursa burada heç bir şəkildə şiə məzhəbinin nəzərdə tutduğu imam məqamı qəsd oluna bilməz. Bu nöqtə gördüyümüz kimi həm ayənin məzmunundan, həm də digər ayələrdə "xəlifə" sözünün işləndiyi mənalardan anlaşılır. Çünki bunun əksini iddia etmək və Allahın "xəlifə" ilə muradanının məsum imamlar olduğunu iddia etmək mələkləri Allahın muradını anlamamaqda, dolayısıyla xəta etməkdə ittiham etməkdir. Məlumdur ki, mələklər xəta etməzlər.

Müzakirə müqabilimiz Qurban bəy ilə müzakirəmizdə xatırladığım məsələlərdən biri də budur ki, ayədəki "cəil" sözü ismu-fail olmaq surəti ilə davamiyyət ifadə edir. Binaən aleyhi bütün zamanlarda yer üzündə xəlifənin olduğunu əsaslandırmağa və bu xəlifə sifətinin peyğəmbərlərə və məsum imamlara aid olduğunu göstərməyə çalışır. Maraqlı tərəf budur ki, şiə təfsir kitablarına nəzər saldığımızda bu cür istidlal ilə rastlaşmadıq. Təbii ki, bütün şiə təfsirlərini vərəqlədiyimizi iddia etmirik, lakin ən məşhur təfsir kitablarına göz gəzdirdiyimizdə hansısa şiə aliminin bunu bu şəkildə imamətin davamiyyəti üçün dəlil gətirdiyini görmədik. Əksinə buradakı "cəil" sözünün sadəcə gələcəyi ifadə etdiyini deyənlər rastımıza çıxdı. Misal üçün Fəthullah əl-Kəşəni yazır ki, "cəalə" feli burada "gələcək mənasını ifadə edir."[191] Yəni davamiyyət yox, lakin Allahın gələcəkdə edəcəyi bir feli mələklərinə xəbər verməsini qəsd edir. Bu, ayədən çox aşkar görünür və ismu fail hər zaman davamiyyət ifadə etməz. Misal üçün Allahu təalə buyurur: "Biz Musanın anasına: "Onu əmizdir. Ondan ötrü qorxduqda isə onu çaya at. Qorxma və kədərlənmə. Çünki Biz onu sənə qaytaracaq və

---

[189] Şirazi, "əl-Əmsəl fi Təfsir Kitəb Allah əl-Munzəl", 1/111-112; Muəssəsətul-Alə lil-Mətbuat, Beyrut, 1434

[190] ət-Tabətabəi, "əl-Mizən fi Təfsir əl-Quran", 1/116; Cəməatul-Mudərrisin, Qum

[191] əl-Kəşəni, "Zubdətut-Təfəsir", 1/113; Muəssəsətu əl-Məarif əl-İsləmiyyə, 1423

onu elçilərimizdən biri edəcəyik"(– deyə) təlqin etdik." [28:7] Ayədə "qaytaracaq" sözü "radd" olaraq, "edəcəyik" sözü isə "cail" olaraq ismu-fail şəklində keçməkdədir və hər kəs anlayır ki, bunların heç birində davamiyyət qəsd oluna bilməz.

Bu ayəni həmçinin dəlil gətirib iddia edirlər ki, Allah burada "cail" deməklə imamət məqamını insanların ixtiyarına buraxmadığını, lakin Özünün təyinatı ilə həyata keçirdiyini bildirir. Bu iddianın dayandığı ciddi bir arqument yoxdur, çünki Allah Kitabında bir şeyi etdiyini deyirsə bu heç bir şəkildə başqasının da onu etməsinin haram olmasına dəlalət etməz. Allah - subhənəhu va təalə - buyurur: "Allah sizin üçün özünüzdən zövcələr yaratdı.." [16:72] Burada da eynə şəkildə Allah "cəalə" felini istifə edir. Əgər biz "cəalə" felini mütləq şəkildə o mənada anlasaq tamamilə xətalı nəticələrə vararıq, çünki şübhəsiz ki, hər bir kəsin öz zövcəsini seçməsi icazəlidir. Yaxud da Allah – cəllə cələluhu – buyurur: "(Ona belə vəhy olundu: ) "Ey Zəkəriyyə, Biz səni Yəhya adlı bir oğulla müjdələyirik! Bundan əvvəl bu adı heç kimə verməmişik." [19:7] Allahın – təbərakə va təalə - kiməsə ad verməsi dəlil ola bilməz ki, insanların öz övladlarına ad verməkləri icazəli deyildir. Ona görə də Allahın kimisə xəlifə təyin etməsi dəlil ola bilməz ki, insanlar özlərinə xəlifə seçə bilməzlər.

Çox maraqlıdır ki, əhlüs-sünnət alimləri də bu ayədə imam məqamının əhəmiyyətini anlayıblar və bu ayəni imam təyin etməyin vacibliyinə dair dəlil göstərdikdə imamı seçmək barəsində danışıblar. əl-Qurtubi bu barədə deyir: "Bu ayə, bir imam və xəlifənin təyin edilməsinin əsasını təşkil edir; ona itaət edilib tabe olunmalıdır ki, ümmətin birliyi təmin olunsun və xəlifənin hökmləri icra edilsin. Ümmət və imamlar arasında bunun vacibliyi barədə heç bir ixtilaf yoxdur, yalnız şəriətdən bixəbər olan Əsəmdən və onun fikrinə, məzhəbinə tabe olub eyni görüşü müdafiə edənlərdən başqa. O, bunun dində vacib olmadığını, əksinə caiz olduğunu söyləmişdir. Onun fikrincə, əgər ümmət öz həcc və cihadlarını yerinə yetirsələr, aralarında ədalətli davransalar, özləri haqqı təmin etsələr, qənimətləri, fey və sədəqələri sahiblərinə paylasalar və cəza tədbirlərini layiq olanlara tətbiq etsələr, bu kifayətdir və onlar üçün bir imamın təyin olunması vacib deyil. Bizim dəlilimiz isə Allah-Təalanın 'Mən yer üzündə bir xəlifə təyin edəcəyəm' sözüdür."[192] Bəli, bu ayə imam məqamının dövlət başçısı kimi, müsəlman cəmiyyətini idarə edəcək bir rəhbər kimi

[192] əl-Qurtubi, "əl-Cami li Əhkəm əl-Quran", 1/264;

vacibliyi üçün dəlil göstərilə bilər, həmçinin ümmətin başsız qalmasının caiz olmadığını əsas gətirilə bilər, lakin heç bir şəkildə imamın yalnız və yalnız Allah tərəfindən seçilməsinin vacibliyinə dəlalət etməz.

## İbrahimin imamlığı

Sözümüzün bu hissəsində qeyd etməliyik ki, İmamət məqamının üstünlüyü və müstəqilliyi ilə bağlı imami şiələrinin əsaslandıqları ən əsas dəlil Bəqərə surəsindəki bu ayədir. Allah - cəllə cələluhu - buyurur: “**Vaxtilə Rəbbi İbrahimi bir neçə sözlə sınağa çəkmişdi. O da onları tamamilə yerinə yetirdi. Allah dedi: “Mən səni insanlara imam təyin edəcəyəm!” (İbrahim:) “Nəslimdən də!” - dedi. Allah: “Zalımlar Mənim əhdimə nail ola bilməzlər”, - buyurdu.**” [2:124] əl-Kuleyni “əl-Kafi” kitabında rəvayət edir ki, Muhəmməd əl-Baqir deyib: “Həqiqətən, Allah İbrahimi qulu olaraq seçdi, sonra onu peyğəmbər etdi, və onu peyğəmbər etdikdən sonra rasul olaraq seçdi, və onu rasul olaraq seçdikdən sonra xəlil etdi, və onu xəlil etdikdən sonra imam olaraq təyin etdi. Allah ona bütün bu mərtəbələri verdikdən sonra "— (bunu deyərkən imam) əlini yumruq şəklində sıxdı— "ona dedi: 'Ey İbrahim, mən səni insanlar üçün imam edirəm.' İbrahim (aleyhissalam) bu böyüklüyün dəyərini anlayanda dedi: 'Ey Rəbbim, bəs mənim nəslimdən olanlar necə?' Allah dedi: 'Mənim əhdim zalımlara çatmaz.”[193]

Şiə alimlərindən Seyyid Muhəmməd Said əl-Həkim deyir: “Bütün bunlar peyğəmbərliyin və imamlığın məfhum olaraq fərqli olmasına baxmayaraqdır. İmam, insanların ona tabe olması, ondan öyrənməsi və ona uyması vacib olan şəxsdir, halbuki peyğəmbərlik bunu zəruri etmir. Peyğəmbərin özünə xas müəyyən hökmləri ola bilər ki, insanların bunda ona tabe olmaqları və ondan öyrənməkləri vacib olmaya bilər, hətta onun üzərində bir imam da ola bilər, bu, Hişam bin Səlimdən və digər rəvayətlərdən də aydın olur. Hətta daha əvvəl keçdiyi kimi İbrahim (aleyhissalam) peyğəmbər idi, amma imam deyildi, bu da Qurani-Kərimin başlanğıcındakı mübarək ayənin açıq-

[193] əl-Kuleyni, “əl-Kəfi”, 1/175;

aşkar göstərdiyi kimi, onun imam olaraq təyin edilməsinin sözlərlə sınaqdan keçdikdən sonra olduğunu bildirir. Allah Taala buyurur: "Vaxtilə Rəbbi İbrahimi bir neçə sözlə sınağa çəkmişdi. O da onları tamamilə yerinə yetirdi. Allah dedi: “Mən səni insanlara imam təyin edəcəyəm!” (İbrahim:) “Nəslimdən də!” - dedi. Allah: “Zalımlar Mənim əhdimə nail ola bilməzlər”, - buyurdu.”[194] Bu ayə haqqında danışarkən şiələrin alimlərindən Məkarim əş-Şirazi yazır: “Aydın sübutlar göstərir ki, İbrahimə (aleyhissalam) çətin imtahanlardan sonra, yəqinlik, cəsarət və səbat mərhələlərini keçdikdən sonra verilən imamlıq məqamı müjdə, təbliğ və xəbərdarlıq məqamından fərqlidir.”[195] Həmçinin ət-Tabətabəi “əl-Mizən” təfsirində yazır: “Bu verilmiş imamət yalnız Allahın onu sınaqlarla imtahan etməsindən sonra ona verilmişdir.”[196] İbrahimin çətin sınaqlar keçməsindən, bu məşəqqətlərə, ibtilalara baxmayaraq səbr və səbat göstərməsindən sonra Allahın onu “insanların imamı” olaraq mükafatlandırması doğrudur. Beləliklə də bu şiə alimlərinin sözlərindən də anlaşılır ki, İbrahim peyğəmbər Allahın ona verdiyi bu imamət məqamına göstərdiyi səbr və səbatdan, saleh əməllərdən sonra layiq oldu, yəni “istihqaq” etdi. Şeyx əs-Saduq bunu daha aşkar şəkildə belə izah edir: “Allah Taala’nın “Vaxtilə Rəbbi İbrahimi bir neçə sözlə sınağa çəkmişdi. O da onları tamamilə yerinə yetirdi” [2:124] sözlərində başqa bir təfsir də vardır ki, bizim qeyd etdiyimiz bunun əsasını təşkil edir. Sınaqlar iki növdür: bunlardan birincisi Allah üçün qeyri-mümkündür, ikincisi isə mümkündür. Qeyri-mümkün olan, gələcək günlərin nə göstərəcəyini öyrənmək üçün sınaq etməsidir və bu, Allah üçün münasib deyildir, çünki O, Uca Allah, qeybi bilir. Sınağın digər növü isə budur ki, Allah onu imtahan edir ki, ona verdiyi sınaqlara səbr etsin, beləliklə də ona verdiyi mükafatı layiq (istihqaq) olduğu üçün vermiş olsun, həmçinin başqaları ona baxaraq nümunə götürsün. Beləliklə, Allahın hikmətindən məlum olur ki, O, imamətin səbəblərini yalnız kifayət qədər bacarıqlı və müstəqil olan şəxsə həvalə edir.”[197] ət-Tabrasi “Məcmə əl-Bəyan” təfsirində bu sözləri ondan nəql edir və heç bir etiraza yer vermir. Buradakı “imamlıq məqamının”, İbrahimin daha əvvəl sahib olmadığı imamət məqamı, yəni şiələrin təsəvvüründəki imamət məqamı olduğunu demək bu baxımdan ciddi bir problemlə qarşılaşır, çünki imami məzhəbinə görə imamət “layiqlik”

---

[194] əl-Həkim, “əl-Muhkəm fi Usul əl-Fiqh”, 1/250;
[195] əş-Şirazi, “əl-Əmsəl fi Təfsir əl-Quran”, 1/370;
[196] ət-Tabətabəi, “Təfsir əl-Mizən”, 1/268;
[197] əs-Saduq, “Məani əl-Əxbər”, səh: 127;

(istihqaq) ilə olmur, yəni heç kim imamlıq məqamına saleh əməllər etmək, ibadət və itaətdə zirvələrə çıxmaqla nail ola bilməz. İmamət Allahın fəzli və lütfüdür, dilədiyi kəsə verər. əl-Kuleyni “Usul əl-Kəfi” kitabında İmam ər-Rida’nın belə dediyini rəvayət edir: “İmam öz dövründə təkdir, ona heç kim yaxın düşə bilməz, heç bir alim ona bərabər ola bilməz, onu əvəz edəcək biri tapılmaz və ona bənzər, ya oxşar birisi yoxdur. O, özü istəmədən və özü bunu qazanmadan İmam öz dövründə təkdir, ona heç kim bərabər ola bilməz, heç bir alim onu tənzimləyə bilməz, ondan bir əvəz tapılmaz və ona bənzər, ya oxşar birisi yoxdur. O, bütövlüklə Allahın fəzlinə məxsusdur, özü bunu istəməyib, nə də özü bunu qazanıb. Əksinə, bu, bütün nemətləri bəxş edənin (yəni Allahın) xüsusi lütfüdür.”[198] Şeyx əl-Mufid yazır: “Peyğəmbərliklə bağlı rəyimiz: O, bir lütfdür, yoxsa layiq olmaq məsələsidir? Deyirəm ki, peyğəmbərlik Uca Allahın bir lütfüdür, O, onun gözəl sonluğunu bildiyi üçün, peyğəmbərliyi tələb edən bütün keyfiyyətlərin onda birləşməsi səbəbilə, onu başqalarından üstün tutaraq öz kəraməti ilə təltif etdiyi bir şəxsi seçir… İmamət məsələsinə gəlincə: O, Allahın bir lütfüdür, yoxsa layiq olmaq məsələsidir? Deyirəm ki, daha əvvəl peyğəmbərlik haqqında izah etdiyimiz kimi imamətin təyin edilməsi, Allahın bunu imama bir lütf olaraq verməsidir.”[199] Tələbəsi Seyyid əl-Murtəda isə deyir: “Bizim tutduğumuz mövqe budur ki, imamət də - peyğəmbərlik də - layiq olmaq əsasında qazanılmır. Əshabımızdan bir qrupun onların (imamət və peyğəmbərliyin) mükafat və əvəz olaraq layiq olduğunu iddia etməsi batildir və bunda heç bir şübhə ola bilməz. İmamət və peyğəmbərliyin layiqlik ilə olması fikrinin yanlış olduğunu bir çox yolla sübut etmək olar: Kitabın müəllifinin (yəni əl-Qadi Abdulcəbbarın) işarə etdiyi çətinlik və külfət məsələsi bu yollardan biridir və ən güclüsüdür. Biz, imamətin, daha əvvəl edilmiş əməllərin nəticəsində layiq olmaqla əldə edildiyini deməsək də, onu yalnız ən fəzilətli (əfzəl) şəxs üçün vacib görürük… Bununla belə layiqlik rəyində olanların, onun hekayət etdiyini imamətin vacibliyi üçün dəlill gətirməkləri doğru deyildir, çünki elə ola bilər ki, heç bir dövrdə kimsənin əməlləri imamətə layiq olacaq qədər olmasın. Hər dövrdə bu səviyyəyə çatan kimsənin olması zəruri deyil.”[200] Şərif əl-Murtəda çox gözəl bilir ki, imami məzhəbinə görə hər bir zaman bəşəriyyət üçün imamları təyin etmək Allah üçün vacibdir;

[198] əl-Kuleyni, “əl-Kəfi”, 1/201;

[199] əl-Mufid, “Əvail əl-Məqalət”, səh: 63-64;

[200] əl-Murtəda, “əş-Şəfi fil-İmamə”, 1/326-327;

əgər imamət məqamı layiqlik (istihqaq) ilə olsaydı, hansısa zamanda həmin layiqlik həddinə çatacaq bir kimsənin olmaması həmin zamanı imamsız buraxmış olacaq. Bu isə imamiyyə məzhəbinə görə batildir, belə bir şeyi imami şiələri rədd edirlər. Üstəlik imaməti peyğəmbərlik məqamı ilə eyniləşdirdikləri üçün imamların da peyğəmbərlər kimi Allahın fəzli və lütfü ilə seçildiklərini deyirlər. əl-Murtəda'nın sözləri ilə bağlı haşiyəyə çıxan Abduz-Zəhra əl-Hüseyni əl-Xatib deyir: "Yəni (bəzi insanlar iddia edirlər ki,) imamət, əməllər və ibadətlər kimi insanların zahirdə görə bildikləri vəsflərə sahib olmaqla qazanılır. Lakin əl-Murtəda bunu rədd etmişdir və bunu deyənlərin səhv olduğunu bildirmişdir, çünki imamət peyğəmbərlik kimi yalnız Allah tərəfindən seçilməklə olur. "Allah risalətini harada yerləşdirəcəyini daha yaxşı bilir". Allah Təala İsa peyğəmbəri - aleyhissələm - doğulduğu an peyğəmbər etdi, bundan əvvəl onun heç bir əvvəlki əməli və ibadəti olmamışdı. Eyni şəkildə, O, Yəhyanı - aleyhissələm - seçdi və ona uşaq ikən hikmət verdi. İmamət üçün də eyni şey keçərlidir."[201] Əgər imamət haqqında əl-Mufid'in, əl-Murtəda və başqalarının dedikləri doğrudursa o zaman İbrahimə verilən imamət həmin imamət ola bilməz, çünki şiə alimlərinin öz sözlərindən və ayəyə verdikləri izahlardan öyrənmiş olduq ki, İbrahim peyğəmbər, ona verilən məqama və ətaya məşəqqətli sınaqlardan keçdikdən sonra layiq olmuşdur. Beləliklə də ayədəki imamlıq məqamı ilə şiələrdəki imamlıq arasında bu baxımdan bir ziddiyyət vardır.

Ayənin imamiyyə etiqadı ilə uyğunsuzluğunun daha bir göstəricisi ilə tanış olmağımız lazımdır. Bir daha xatırlatmalıyıq ki, şiələrdə imam anlayışı həm dini, həm də dünyəvi sahədə riyasəti, siyasi liderliyi qəsd edir. Dini planda imam olmaq, dini doğru anlamaqda və dini təlimləri öyrətməkdə əsas çıxış nöqtəsi olmaq, dinin mühafizəsində isə bir himayədar olmaq deməkdir. Siyasi sahədə imam olmaq isə insanların başında siyasi hökmranlığa malik olmaqdan, onların dünyəvi işlərini idarə etməkdən ibarətdir; burada ən əsas vəzifə Allahın hökmlərini insanların üzərində tətbiq etmək və ilahi ədalətin cəmiyyətdə əks olunmasını təmin etmək qeyd edilə bilər. Burada ət-Tabrasi'dən daha əvvəl nəql etdiyimiz sitata bir daha yer verməkdə fayda var, beləki o buyurur: "İmam ləfzindən iki məna anlaşıla bilər. Birinci mənada, o, fellərində və sözlərində tabe olunan, izlənilən biridir. İkinci mənada isə o, ümmətin və siyasətinin tədbiri ilə məşğuldur, onun işlərini yerinə

[201] Eyni mənbə, 1/326;

yetirən, cinayətkarlarını cəzalandıran, valilərini təyin edən, layiq olanlara hədd cəzalarını tətbiq edən, düşmənlərinə qarşı vuruşandır. Birinci mənada peyğəmbərlərdən hər biri imamdır. İkinci mənada isə hər bir peyğəmbərin imam olması vacib deyildir, çünki cinayətkarları cəzalandırmaqla, düşmənlərə qarşı vuruşmaqla, dinin sərhədlərini qorumaqla, kafirlərə qarşı cihad etməklə vəzifələndirilməmiş olması mümkündür."[202]" İbrahim peyğəmbərin ayədə deyildiyi kimi "insanlara imam edilməsi" birinci mənada ola bilməz, çünki onsuz da İbrahim bir peyğəmbər olaraq bu vəsfə malik idi. İbrahimin dəvətinə tabe olmuş az sayda insan çox gözəl bilirdi ki, İbrahimin sözünə itaət etmək bir fərzdir. Bu mənada hər bir peyğəmbər - ət-Tabrasi'nin də təsdiqlədiyi kimi - bir imamdır. O zaman yerdə ikinci variant qalır və bu, dini və dünyəvi işlərdə ümumi riyasət mənasıdır. Yəni əmir, hakim, siyasi başçı mənası qalır və biz bu mənanı ayəyə tətbiq etdiyimizdə belə bir nəticə çıxır: "Mən səni insanların üzərində əmir və rəis olaraq, onların dini və dünyəvi işlərində hakim olaraq təyin edirəm." Belə bir təfsirin doğru olmadığı aşkardır, çünki İbrahim peyğəmbər siyasi lider olmayıb, hansısa bir qövm üzərində hakimlik vəzifəsinə keçməyib. ət-Tabətabəi deyir: "Bu təfsir və ona bənzəyən digər təfsirlər, zaman keçdikcə insanların gözündə Qurani-Kərimdəki bəzi sözlərin mənalarının aşınmasından qaynaqlanır. Bu sözlərdən biri də 'imamət' sözüdür. Bəzi insanlar onu peyğəmbərlik, liderlik və ya mütləq itaət mənasında şərh ediblər, digərləri isə onu xilafət, vəsilik və ya dini və dünyəvi işlərdə liderlik mənasında təfsir ediblər—lakin bu təfsirlərin heç biri doğru deyil."[203] Muhəmməd Hüseyn Tərhini yazır: "Bu (təfsir) doğru deyildir, çünki İbrahim peyğəmbər nə bir əmir, nə rəis, nə də hakim olub. Biz burda deyirik ki, Allah - subhənəhu va təalə - İbrahimi qüdvət (etalon) mənasında bir imam etmək istəyib, yoxsa biz (şiələr)dəki kimi termin olaraq imamət mənasını qəsd etməyib. Bu daha doğru təfsirdir. Şübhəsiz ki, İbrahim, itaət olunan bir xəlifə və hakim olmayıb, sadəcə nümunə götürülsün və tabe olunsun deyə bir qüdvət və nümunə olub. İmam isə bizə görə Allahın təyinatı ilə insanların işlərini idarə edən xəlifə və ya hakimdir, sadəcə nümunə mənasında deyildir."[204] Əgər bu ayədə şiələrdəki terminoloji imamlıq qəsd olunursa o zaman iki ehtimaldan birini deməliyik: ya Allah İbrahimə imam, hakim vəzifəsi verib, lakin İbrahim imtina edib, ya da İbrahimin hakim olmasını

[202] ət-Tabərsi, "Məcmə əl-Bəyan", 1/276-277;

[203] Bax: ət-Tabətabəi, "Təfsirul-Mizən", 1/271;

[204] Tərhini, "Aqaidul-İməmiyyə beynəl-Əsil vad-Dəxil", səh: 416-417;

gərəkdirəcək siyasi düzən olmayıb. Hər iki ehtimal imkansızdır. Ona görə də burada "imam" sözü ilə şiələrdəki terminoloji imamət qəsd olunmur. Seyyid Muhəmməd Hüseyn Fədlullah da bunu təsdiqləyərək buyurur: "Biz bəyan etdik ki, Quranda sözü keçən imamlıq ilə termin olaraq imamlıq yox, sadəcə olaraq peyğəmbərlik qəsd olunur. Beləliklə də hər bir peyğəmbər bir imam olub, ona görə də hər bir imamın peyğəmbər olması zəruri deyildir."[205] Bu baxımdan İbrahimə nisbət edilmiş imamlıq məqamı peyğəmbərlik məqamından fərqli bir şey deyildi. Allah onu insanların üzərində bir hakim, bir imam yox, insanlar üçün nümunə olacaq bir peyğəmbər etdi. Ona görə də ayədə "insanların üzərində" yox, məhz "insanlar üçün" təbiri keçir. Bu məna həm də onun zürriyətindən çıxarılmış peyğəmbərlərlə də öz təsdiqini tapır. Allah buyurur: "*Daha sonra onun zürriyyətindən doğru yolu göstərən imamlar çıxardı. "Biz ona İshaqı və bir də Yaqubu bağışlayıb hamısını əməlisaleh insanlar etdik. Biz Öz hökmümüzlə onları doğru yolu göstərən imamlar etdik. Onlara xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız Bizə ibadət edirdilər.*" [21:72-73] Aydın olur ki, Allah - cəllə cələluhu - burada İbrahimə verdiyi vədi əks etdirir. İbrahimə övladlar olaraq İshaqı və sonra Yaqubu verdi və hamısını imamlar etdiyini deyir. Burada imam sözü ilə şübhəsiz ki, insanlara doğru olanı öyrədən, onlar üçün nümunə olan şəxsləri qəsd edir, beləki ayədə "imamlar" dedikdə onları "əmrimizlə hidayət edənlər" olaraq vəsf edir. Hidayət etmək Allahın peyğəmbərlərə aid etdiyi bir vəsfdir. Məlumdur ki, nə İshaq peyğəmbər, nə də Yaqub peyğəmbər dünyəvi məsələlərdə kiçik və ya böyük hansısa bir cəmiyyəti idarə edən hökmdar olmayıblar. İbrahim peyğəmbərin - aleyhissələm - nəslində dövlət idarə etmək mənasında ilk dəfə imam olan şəxs Yusuf peyğəmbər olub. Yaqub isə öz ailəsinin başçısı olub, hansısa bir dövlət üzərində hökmranlığı olmayıb. Yusufa gəldikdə Allah - cəllə cələluhu - buyurur: "*Beləliklə, Yusufu o yerdə yüksək mövqe sahibi etdik. O, istədiyi yerdə qalırdı (və istədiyi kimi hərəkət edirdi.) Biz, dilədiyimiz kimsəyə rəhmətimizi çatdırarıq və gözəl əməl sahiblərinin mükafatını zay etmərik.*"[12:56]

Bu dediklərimizdən əmin olmaq üçün hər bir kəs özünə belə bir sual verməlidir. Allahın İbrahim peyğəmbərə aid etdiyi "insanlar üçün imam" statusundan sonra dəyişən nə oldu? İbrahim peyğəmbər bundan əvvəl məsum idi, Rəbbindən vəhy alırdı, ətrafındakı azsaylı

---

[205] https://sayedfadlullah.com/sub_category/50/283

insanlar üçün sözünə itaət etmək bir fərziyyət idi. Daha əvvəl bir hakim deyildi, kiçik və ya böyük olmağından asılı olmayaraq hansısa siyasi bir strukturu idarə edən bir əmir deyildi və "insanlar üçün imam" məqamından sonra da bu nöqtədə bir dəyişiklik olmadı. Bəs o zaman ayədən başa düşməli olduğumuz doğru məna nədir? Ayənin doğru anlayışı budur ki, Allah - cəllə va alə - İbrahim peyğəmbəri ümumilikdə bütün insanlar üçün tabe olunan, nümunə götürülən bir imam edəcəyini vəd edir. Həqiqətən də İbrahim peyğəmbər - aleyhissələm - bu gün xristianların, yəhudilərin və müsəlmanların itaət etdiklərini iddia etdikləri ən bariz şəxsiyyətdir. Bu dinin nümayəndələri İbrahimə tabe olmaqla ona yaxın olduqlarını iddia edirdilər. Bunu biz növbəti ayələrdən başa düşürük: "*Ey kitab əhli, nə üçün İbrahim barəsində mübahisə edirsiniz? Halbuki Tövrat və İncil ondan sonra nazil edilmişdir. Siz heç düşünmürsünüzmü? Baxın, siz bildiyiniz şeylər barəsində mübahisə etmişdiniz. Bəs bilmədiyiniz şeylər barəsində nə üçün mübahisə edirsiniz? Allah bilir, siz isə bilməzsiniz. İbrahim nə yəhudi, nə də xristian idi. O, ancaq hənif (Allahın birliyini tanıyan) bir müsəlman idi və (Allaha) şərik qoşanlardan deyildi. Şübhəsiz ki, insanların İbrahimə ən yaxın olanı, onun ardınca gedənlər, bu Peyğəmbər və (ona) iman gətirənlərdir. Allah möminlərin dostudur.*" [3:65-68] Ibrahimə verdiyi bu vədin gərəyi olaraq Nəhl surəsində peyğəmbərimizə də belə buyurur: "*Sonra sənə: "Doğru yola yönələrək İbrahimin dininə tabe ol! O, müşriklərdən deyildi", - deyə vəhy etdik.*" [16:123] Böyük təfsir alimi Fəxruddin ər-Razi bu həqiqəti belə ifadə edir: "Allah-Taala İbrahimə - əleyhissalam - insanlara imam təyin edəcəyini vəd etdikdən sonra, Qiyamət gününə qədər bu vədinin haqq olmasını təmin edib. Çünki dinlərin ardıcılları arasındakı böyük fərqlərə və son dərəcə ciddi təzadlara baxmayaraq, hamısı İbrahimə - əleyhissalam - böyük ehtiram göstərir və ona ya nəsildə, ya da din və şəriətdə nisbət edilməkdən şərəf duyurlar. Hətta bütpərəstlər də İbrahimə - əleyhissalam - ehtiram göstərirdilər. Allah-Taala Öz Kitabında belə buyurur: "*Sonra sənə: Hənif olaraq İbrahimin dininə tabe ol! — deyə vəhy etdik.*" [16:123]. Başqa bir yerdə buyurur: "*Özünü ağılsızdan başqa kim İbrahimin dinindən üz çevirə bilər?*" [2:130]. Həcc surəsinin sonunda buyurur: "*Atanız İbrahimin dininə tabe olun! Allah sizi əvvəlcədən müsəlman adlandırdı.*" [22:78]. Muhəmmədin - alehissalətu vassələm - ümmətinin hamısı ona namazın axırında salavat gətirib deyirlər: 'Məhəmmədə və Məhəmmədin ailəsinə

rəhm et, necə ki, İbrahimə və İbrahimin ailəsinə rəhm etdin."[206] Bütün bunların dəlalət etdiyi məna budur ki, İbrahim peyğəmbər bütün bəşəriyyətin tabe olunması vacib olan bir imamdır, əgər bəşəriyyətin ağası Muhamməd əl-Mustafə - aleyhissalətu vassələm - İbrahimin dininə tabe olunmaqla əmr olunubsa o zaman şübhəsiz ki, bu, bütün insanlar üçün də keçərlidir. Hətta şiə təfsir alimi ət-Tabrasi qeyd edir: "Sonra ona hənifilik dini endirildi ki, bu da təmizliyə aid idi və on şeydən ibarət idi—beşi başla, beşi isə bədənlə əlaqədardır. Başla əlaqəli olanlar: bığları qısaltmaq, saqqalı uzatmaq, saçları tərəflərə ayırmaq, misvak istifadə etmək və dişlərin arasını təmizləməkdir. Bədənlə əlaqəli olanlar isə: bədən tüklərini qırxmaq, sünnət etdirmək, dırnaqları kəsmək, cənabətdən sonra qüsl almaq və su ilə təmizlənməkdir. Bu, İbrahim peyğəmbərin gətirdiyi zahiri hənifilikdir ki, nəsx edilməmiş və Qiyamət gününə qədər nəsx edilməyəcək. Bu, "*və İbrahimin hənif dininə tabe o*l" [3:95] ayəsində qeyd olunmuşdur. Bunu Əli ibn İbrahim ibn Haşim öz təfsirində qeyd etmişdir. Qətadə dedi və bu, İbn Abbasdan gələn iki rəvayətdən biridir: On xislət var ki, İbrahim peyğəmbərin şəriətində fərz idi və bizim şəriətimizdə sünnətdir: ağızı yaxalamaq, buruna su çəkmək, saçları tərəflərə ayırmaq, bığları qısaltmaq, misvak istifadə etmək, sünnət olmaq, qasıq tüklərini qırxmaq, qoltuqaltı tükləri yolmaq, dırnaqları kəsmək və su ilə təmizlənmək."[207] Ona görə də əksər təfsir alimləri ayədə keçən "imam" sözündən peyğəmbər məqamından fərqli bir məqam anlamayıb. Nizamuddin əl-Qummi yazır: "Əksər alimlər burada 'imam' ifadəsi ilə "peyğəmbər" mənasının qəsd olunduğunu düşünürlər, çünki o, bütün insanlar üçün imam təyin olunmuşdur. Əgər o, müstəqil bir şəriət sahibi olmasaydı, başqa bir peyğəmbərə tabe olardı və bu da onun ümumi imamlıq mövqeyini batil çıxarmış olardı. 'İmam' ünvanı onun hər bir işdə rəhbər olduğunu bildirir və belə bir mövqeyi olan şəxs peyğəmbər olmalıdır. Allah-Təala ona bu adı bir mərhəmət nişanəsi olaraq verdiyi üçün, bunu imamlığın ən yüksək dərəcəsi kimi başa düşmək lazımdır, "*Biz onları öz əmrimizlə yol göstərən imamlar etdik*" [32:24] ayəsində olduğu kimi, xəlifə, hakim, fəqih və ya namaz imamı kimi dini təqlid ediləcək bir şəxs kimi anlaşılmamalıdır. Allah həqiqətən də bu vədi yerinə yetirdi, onu bütün dinlərin ardıcıllarının gözündə uca bir mövqeyə qaldırdı. Ondan sonra gələn peyğəmbərlər də dinlərinin üsulunda onu özlərinə nümunə götürdülər, "*Sonra sənə, (ey*

---

[206] "Təfsir ər-Razi", 4/36;

[207] ət-Tabrasi, "Məcmə əl-Bəyan", 1/374;

*Məhəmməd), ibrahimin hənif dininə tabe olmağını vəhy etdik"* [16:123]. Və bu, böyük bir şərəfdir ki, Məhəmmədin (s) ümməti namazlarında belə deyir: *"Ey Allah, Məhəmmədə və onun ailəsinə, İbrahimə və onun ailəsinə verdiyin xeyir-dua kimi xeyir-dua ver.*'"[208]

Burada onu da əlavə etməliyik ki, İbrahim peyğəmbərə verilmiş imamlıq məqamı eynilə Allahın saleh qullarının istədikləri duanın cavabı idi: "*Onlar deyərlər: "Ey Rəbbimiz! Bizə gözümüzün aydınlığı olan zövcələr və övladlar bəxş et və bizi müttəqilərə imam et!*" [25:74] Həqiqətən də Allah - cəllə cəlaluhu - İbrahimin zürriyyətindən peyğəmbərlər və insanlara öndər olacaq şəxsiyyətlər çıxardı. Bir başqa ayədə buyurur: "*Biz istədik ki, həmin yerdə aciz qalanlara mərhəmət göstərək, onları öndə gedənlər (imamlar) və varislər edək, yer üzündə onlara hökmranlıq bəxş edək, Firona, Hamana və onların əsgərlərinə qorxub çəkindikləri şeyi göstərək.*" [28:5-6] ət-Tabərsi bu ayənin təfsirində deyir: "(Allah buyurur:) "*Biz istədik ki, həmin yerdə aciz qalanlara mərhəmət göstərək.*" Mənası budur ki, Firon İsrail oğullarını məhv etmək və onları yox etmək istəyirdi. Amma Biz onlara lütf etmək niyyətindəyik. *"Onları imamlar edək"*, yəni xeyir işlərdə rəhbər və öndərlər edək ki, insanlar onlara tabe olsunlar, bu da İbn Abbasdan nəql edilib. Digər rəydə isə deyilir: Biz onları hökmdarlar və padşahlar edəcəyik, bu da Qətadədən nəql edilib. Bu fikir birinciyə oxşayır, çünki Allahın hökmdar etdiyi şəxslər elə rəhbərlərdir və Allah heç vaxt insanları zülm və ədalətsizliklə idarə edən birinə rəhbərlik verməz. Uca Allah buyurur: "*Doğrudan da, Biz İbrahim nəslinə kitabı və hikməti verdik, və onlara böyük bir hökmranlıq verdik*". Allah tərəfindən verilən hökmranlıq itaət edilməli olan hökmranlıqdır. Buna görə də imamlar bu mənada həm dində, həm də dünyada öncə gələn hökmdarlardır ki, başqaları onların izi ilə gedir."[209]

Üstəlik bu ayədən şiə alimlərinin çıxardığı daha bir hökm məsumluq ilə bağlıdır. Ayədə "zalım" sözündən çıxış edərək qeyd edirlər ki, həyatında bir an da olsa zülm etmiş hər kəs "zalım" sayılır və ayənin hökmü ilə Allahın əhdinə nail ola bilməz. Bununla bağlı ət-Tabətabəi buyurur: "Bu izahla aydın olur ki, Allahın 'O - "Nəslimdən də!" - dedi. Allah: "Zalımlar Mənim əhdimə nail ola bilməzlər", - buyurdu. [2:124] ayəsində 'zalımlar' dedikdə, hər hansı bir formada

[208] ən-Nisəburi, "Ğaraibul-Quran va Rağaibul-Furqan", 1/387;

[209] ət-Tabərsi, "Məcmə əl-Bəyan", 7/414;

zülm etmiş hər kəs nəzərdə tutulur, istər şirklə, istərsə də günahla olsun, hətta ömrünün qısa bir dövründə baş vermiş və sonra tövbə edib düzəlmiş olsun."[210] Ondan əvvəl ət-Tabrasi bununla bağlı belə yazırdı: "Alimlərimiz yalnız çirkin işlərdən məsum olan bir kimsənin imam ola biləcəyinə dair bu ayəni dəlil gətirirlər, çünki Allaha təala Öz əhdinin - və bu, imamətdir - zalım birinə çatmayacağını bildirmişdir. Məsum olmayan şəxs isə, ya özünə, ya da başqasına qarşı zalım ola bilər. Əgər deyilsə ki, ayə yalnız zalımın zülm etdiyi halda ona çatmayacağını bildirir, tövbə etdikdən sonra o artıq zalım adlanmaz və ona imamət çata bilər, cavabımız belə olar: Zalım tövbə etsə belə, o hələ də zülm etdiyi halda ayə tərəfindən əhatə olunmuşdur. Buna görə də, Allah onu istisna edəndə, bu onun heç vaxt imamətə nail ola bilməyəcəyi hökmünü verir. Ayə mütləqdir və müəyyən bir zamana aid deyil, buna görə də bütün zamanlar üçün keçərlidir, yəni zalım tövbə etsə belə, imamətə nail ola bilməz."[211] Müasir şiə alimlərindən Cəfər əs-Subhəni məsələni bu şəkildə izah edir: "İnsanlar zülm baxımından dörd qismə bölünürlər:

1. Bütün ömrü boyu zalım olanlar.
2. Bütün ömrü boyu pak və təmiz olanlar.
3. Ömrünün əvvəlində zalım olub, sonunda tövbə edənlər.
4. Ömrünün əvvəlində pak olub, sonunda zalım olanlar.

Bu halda dayanıb düşünmək lazımdır ki, İbrahim - aleyhissələm - övladlarından bəziləri üçün imamət istədikdə, onların hansı qismini nəzərdə tutmuşdu? İbrahimin - aleyhissələm - imaməti birinci və dördüncü qisim övladları üçün istəməsi mümkün deyil. Çünki ömrü boyu zülmə qərq olmuş və ya imamət dövründə zülm etmiş biri bu məqama etibar edilə bilməz. Beləliklə, geriyə yalnız ikinci və üçüncü qisim qalır. Allah-Təala açıq şəkildə 'Mənim əhdim zalımlara çatmaz' buyurduğuna görə, bu ifadədə 'zalım' sözü yalnız üçüncü qismin - yəni, ömrünün əvvəlində zalım olub, imamət dövründə tövbə edənlərin - üzərinə tətbiq oluna bilər. Belə olduqda, bu qisim də istisna olunur və yalnız ikinci qisim qalır: yəni, ömrü boyu pak və təmiz olan, imamətdən əvvəl və sonra haqq yoldan sapmayan və düz yoldan çıxmayan kəslər."[212] Bu dəlilləndirmə tərzinə şiə alimləri rübai təqsim deyirlər. Üstəlik diqqət etdiyiniz kimi bu xətti izləyən şiə alimləri qeyd edirlər ki,

---

[210] ət-Tabətabəi, "Təfsir əl-Mizən", 1/274;

[211] ət-Tabrasi, "Məcmə əl-Bəyan", 1/378;

[212] əs-Subhəni, "Məfəhim əl-Quran", 5/414-415;

ayədə zülm deyildikdə təkcə şirk qəsd olunmur, lakin hər növ günah qəsd olunur. Bunu əs-Subhəni bir başqa kitabında bu sözləri ilə təsdiqləyir: “Sonra isə müəyyənlik artiklı ilə işlənmiş cəm formasından aydın olur ki, zülmün hər cür növü və forması bu ilahi məqama çatmağa mane olur. Nəticə etibarilə, zülm etmiş hər bir fərdin imamət məqamına yüksəlməsi qadağandır—istər ömrünün bir dövründə zalım olub, sonra tövbə edərək zalımlıqdan çıxmış olsun, istərsə də zülmü davam etdirmiş olsun… Bunun əsasında, həyatının hər hansı bir günündə zülm edən, bir həddi aşan, bütə ibadət edən və ümumiyyətlə, hələ küfr bir tərəfdə qalsın, haram olan istənilən bir şeyi törədən şəxsin imamət məqamına layiq olması mümkün deyil. Bunun labüd nəticəsi isə budur ki, imam günahdan tamamilə pak olmalıdır—özü üçün dini vəzifələrin təyin edildiyi ilk andan ömrünün sonuna qədər. Məhz bu, imamiyyə şiələrinin imamın məsum (günahsız) olması barədə mövqeyidir."[213] Bir digər müasir şiə alimi Məkarim əş-Şirazi yazır: “Qurani-Kərimdə "zülm" ifadəsinin "لَا يَنَالُ عَهْدِي الظَّالِمِين" ayəsindəki mənası təkcə başqalarına edilən zülmlə məhdudlaşmır, əksinə zülm ədalətin qarşılığıdır. Burada "zülm" sözü geniş mənada işlədilmiş və ədalətin tam əksi olaraq istifadə edilmişdir. Ədalət isə hər bir şeyi öz yerinə qoymaq deməkdir. Beləliklə, zülm — şəxsin, əməlin və ya hər hansı bir şeyin ona uyğun olmayan bir yerə qoyulmasıdır. İmamət məqamı isə bəşəriyyət üçün həm zahiri, həm də batini rəhbərlik məqamı olub, böyük və ağır məsuliyyətlərə malikdir. Bu səbəbdən, insanın ömrü boyunca bircə anlıq günah və itaətsizlik etməsi belə onun bu məqama layiqliyini əlindən alır.”[214] Beləliklə də şiə alimləri burada iki məsələni isbat etməyə çalışırlar. Birincisi zülm sözünün bütün günahları öz içinə aldığını, ikincisi isə zalım sözünün ömrünün hansısa bir anında zülm etmiş hər kəsə aid olduğunu əsaslandırmağa çalışırlar. Bu isə problemlidir.

Hər şeydən əvvəl qeyd etməyimiz lazımdır ki, belə bir anlayış ilk şiələrin təsəvvürü ilə uyğun gəlmir. ət-Tusi “əl-Əməli” kitabında rəvayət edir ki, “Peyğəmbər - salləllahu aleyhi və alih - buyurdu: "Mən atam İbrahimin duasıyam." Biz dedik: "Ya Rəsulallah, necə oldu ki, sən atan İbrahim peyğəmbərin duası oldun?" Peyğəmbər - salləllahu aleyhi və alih - dedi: "Allah - azzə və cəllə - İbrahimə vəhy etdi: 'Mən səni insanlara imam edəcəyəm.' İbrahim sevincindən rahatladı və dedi: 'Ey

---

[213] əs-Subhəni, “Muhədarat fil-İləhiyyət”, səh: 372;

[214] əş-Şirazi, “əl-Əmsəl fi Təfsir əl-Quran”, 1/272;

Rəbbim, övladlarımdan da mənim kimi imamlar olacaqmı?' Allah - azzə və cəllə - ona vəhy etdi: 'Ey İbrahim, mən sənə elə bir əhd verməröm ki, ona vəfa etməyim.' İbrahim dedi: 'Ey Rəbbim, mənimlə bağladığın əhd nədir ki, ona vəfa etməyəcəksən?' Allah buyurdu: 'Mən zalımlardan heç kimə əhd verməröm.' İbrahim dedi: 'Ey Rəbbim, övladlarımdan hansı zalım olub da Sənin əhdini ala bilməz?' Allah buyurdu: 'Kim Mənim yerimə bütə səcdə edibsə, onu imam etmərəm və imamlıq ona yaraşmaz.' İbrahim dedi: 'Məni və övladlarımı bütlərə ibadət etməkdən uzaq et! Ey Rəbbim, onlar çox insanları azdırmışlar.' Peyğəmbər - salləllahu aleyhi və alih - dedi: "Beləliklə, bu dua mənə və qardaşım Əliyə gəlib çatdı. Bizdən heç kim bütə səcdə etməmişdir. Beləliklə, Allah məni peyğəmbər, Əlini isə vəsi etdi."[215] Uydurma olmasında şəkk olmayan bu rəvayətdə[216] zülm sözünün bütün günahlara aid olmadığı, xüsusilə bütə ibadətə aid olduğu göstərilməkdədir. əl-Kəşəni təfsirinə deyir: "**Əhdim zalımlara çatmayacaq**, yəni, müşriklərə. Çünki Allah **şirki** "zülm" adlandırmışdır və onu böyük bir zülm hesab etmişdir. Buna görə də İbrahim - aleyhissələm - anladı ki, Allahın imamlıq əhdi bütpərəstlərə çatmaz. Beləliklə, o dedi: "**Məni və övladlarımı bütlərə ibadət etməkdən uzaq et!**"[217] Daha sonra əl-Kəşəni "əl-Əməli" kitabındakı rəvayətə yer verir. Şiə alimi Əbu Cəfər ət-Tabəri "əl-Mustərşid" kitabında bu təfsiri imamlara nisbət edir və deyir: "Zalımın halına nəzər saldığımızda görürük ki, ayəni "bütlərə ibadət" edən mənasında təfsir ediblər."[218] Şiə alimi Muhəmməd Rida əl-Kulbeykəni zalım sözünün ərəb dilində özlüyündə ömründə bir dəfə də olsun zülm edən mənasında gəlmədiyini başa düşdüyü üçün deyir: "Lakin bu mövzudakı xəbərlərə baxan şəxs onların çoxluğu ilə birlikdə Peyğəmbərdən - salləllahu aleyhi və alih - və İmamlardan - aleyhimussələm - (zalım sözünün) vaqiədəki mənasını izah etmək üçün nəql edildiyini görər, yoxsa onlar sözün zahirini dəlil gətirməyiblər. Buna şahid olaraq Peyğəmbərin - salləllahu aleyhi və alih - İbrahim - aleyhissələm - haqqında nəql etdiyi bu söz yetərlidir: "Və mənim övladlarımdan zalim olan kimdir ki, Sənin əhdinə nail olmasın?" Allah buyurdu: "Mənə şərik qoşaraq bütə səcdə edən heç vaxt imam

[215] ət-Tusi, "əl-Əməli", səh: 379;

[216] Bunu Abdullah bin Məsud'dan rəvayət edən Mina bin Əbi Mina əl-Xazzəz yalançı rafizi ravidir. İsnadında başqa problemlər də var.

[217] əl-Kəşəni, "ət-Təfsir əs-Safi", 3/89;

[218] ət-Tabəri, "əl-Mustərşid", səh: 648-649;

olmayacaq və imam olmağa layiq deyil."[219] Bütün bunlar doğrudursa, yəni zülm sözü ilə qəsd edilən şirk və bütlərə ibadət mənasıdırsa, o zaman təbii ki, ayədə məsumluğa dair bir dəlil yoxdur.

Şiə alimlərinin verdikləri bu izah nə dil baxımından, nə də səlim əql baxımından dəstəklənmir. Çünki "zalım" adı zülm vəsfini özündə daşıyan adama deyilir, əgər bir kimsə islah olubsa və artıq ədalət, itaət və ibadət vəsfləri ilə tanınırsa ona "zalım" demək özü belə ona qarşı zülmdür. Bu barədə Əbu Bəkr əl-Cəssas deyir: "Bəzi cahil rafizi firqəsinə mənsub olanlar "*Mənim əhdim zalımlara çatmaz*" [2:124] ayəsi ilə Əbu Bəkrin və Ömərin imamətini rədd edirlər, çünki onlar cahiliyyə dövründə müşrik olmuş və zülm etmişdilər. Bu isə aşırı cahillikdir, çünki bu sifət yalnız zülmü davam etdirənlərə aid olur. Tövbə edən şəxsə bu sifət aid edilmir və ona bu hökmü tətbiq etmək düzgün deyil. Əgər hökm bir xüsusiyyətə bağlıdırsa və bu xüsusiyyət aradan qalxıbsa, hökm də aradan qalxır. Zülm sifəti məzəmmətə layiq bir sifətdir və yalnız zülm davam edərkən həmin şəxsə aid edilər. Zülm sona çatdıqda isə bu sifət də aradan qalxır və bununla birlikdə Allahın "*Mənim əhdim zalımlara çatmaz*" hökmü də (onun haqqında) aradan qalxır. Görmürsənmi ki, Allahın "*zülm edənlərə meyl etməyin*" [11:113] ayəsi, yalnız onların zülmü davam etdirdikləri müddətcə onlara meyl etməyi qadağan edir!? Həmçinin, Allahın "*Yaxşı işlər görənlərə heç bir qınaq yoxdur*" [9:91] ayəsi də yalnız onların yaxşı işlərə davam etdiyi müddətcə tətbiq olunur. Beləliklə, "*mənim əhdim zalımlara çatmaz*" ifadəsi, zülmdən tövbə edənləri xaric etmir, çünki onlar artıq zalım adlandırılmırlar. Necə ki, küfrdən tövbə edən şəxs artıq kafir adlandırılmır, fasiqlikdən tövbə edən şəxs fasiq adlandırılmır. Əksinə, 'o kafir idi', 'o fasiq idi', 'o zalım idi' deyilir. Allah Təala "*Mənim əhdim keçmişdə zalım olanlara çatmaz*" deməmişdir; O, yalnız hələ də zalım olaraq xarakterizə edilənləri istisna etmişdir, və bu ad onlara hələ də aid olur."[220] Əlavə edək ki, şiə alimlərinin bu məqamda dedikləri doğru olsaydı o zaman Quranda keçən bütün kafir, fasiq, zalım adlarını da eyni şəkildə tətbiq etməyimiz lazımdır, beləliklə də bu məntiqə əsasən deməliyik ki, ömründə bir dəfə də olsa küfr etmiş şəxs Allahın ayələrdə "kafirlər" olaraq vəsf etdiyi zümrənin içərisinə daxil olur. Ömründə bir dəfə də olsun "fasiqlik" etmiş şəxs ayələrdəki "fasiqlər" adı ilə qəsd etdiyi kəslərin arasına daxildir. Əgər biz bu məntiqi "kafir",

---

[219] əl-Kulbeykəni, "İfədatul-Avaid", 1/77;

[220] əl-Cassəs, "Əhkəmul-Quran", 1/87;

"fasiq" adına tətbiq edə bilmiriksə, o zaman "zalım" adına da tətbiq etməyimiz doğru deyildir.

Əgər "zülm" sözü həqiqətən də kiçik günahdan tutmuş böyük günaha qədər hər bir günaha aiddirsə o zaman keçmiş şiə alimlərinin bu məsələdəki mövqeləri ilə bunun arasında bir uyğunsuzluq mövcuddur. Beləki Şeyx əl-Mufid'in rəyinə görə peyğəmbərlik verilmədən əvvəl bir peyğəmbərin kiçik günah etməsi mümkündür və o, bu rəyi imamiyyə şiələrinin əksəriyyətinə nisbət edir. əl-Mufid yazır: "Həqiqətən, Allahın bütün peyğəmbərləri – Allahın onlara salavatı olsun – həm peyğəmbərlikdən əvvəl, həm də sonra böyük günahlardan və həmçinin sahibini alçaldan kiçik günahların hamısından məsumdurlar. Amma sahibini alçaltmayan kiçik günaha gəldikdə isə belə bir günahın peyğəmbərlikdən əvvəl və məqsədli surətdə olmadan baş verməsi mümkündür. Lakin peyğəmbərlikdən sonra bu, istənilən halda onlar üçün qeyri-mümkündür. Bu, imamiyyə məzhəbinin cumhurunun görüşüdür."[221] əl-Mufid daha sonra imamların məsum olması barəsində danışarkən yazır: "Hökmləri icra etməkdə, hədləri tətbiq etməkdə, şəriətləri qorumaqda və insanları tərbiyə etməkdə peyğəmbərlərin - saləvatullahi aleyhim - məqamında olan imamlar da peyğəmbərlər kimi məsumdurlar. Daha öncə peyğəmbərlər barəsində mümkün olduğunu qeyd etdiyimiz hal istisna olmaqla onlardan heç bir kiçik günahın baş verməsi mümkün deyildir."[222] Əgər əl-Mufid'ə görə - və hətta onun iddiasındakı imamiyyə şiələrinin cumhuruna görə - ən kiçik zülm məqsədsiz də olsa imamdan və hətta peyğəmbərdən sadir ola bilərsə, o zaman yuxarıdakı məntiqə əsasən imamların belə zalım adından qurtulmaqları mümkün olmamalıdır. ət-Tusi rəvayət edir ki, İmam Cəfər əs-Sadiq deyib: "Əli bin əl-Hüseyn - aleyhissələm - məni Minada ikən çadırların ətrafındakı otları qopararkən gördü və dedi: "Ey oğlum, bunu qoparmaq olmaz."[223] Rəvayətin səhih olduğunu deyən Muhəmməd Təqi əl-Məclisi ona izahlar verərkən qarşıya qoyduğu izahlardan birində buyurur ki, "... az yaşlı idi, mükəlləf deyildi və biz, onların kiçik yaşda cahil olmaqlarını mümkün sayırıq."[224] Əgər yuxarıdakı məntiqi bura tətbiq etsək belə demək olar ki, ömründə bir

---

[221] əl-Mufid, "Əvailul-Məqalət", səh: 62

[222] Eyni mənbə, səh: 65;

[223] ət-Tusi, "Təhzibul-Əhkəm", 5/379; əl-Bəhrani "əl-Hədaiq ən-Nədira" kitabında (15/530) səhih olduğunu yazır.

[224] əl-Məclisi, "Ravdatul-Muttəqin", 4/166; Qədim çap.

dəfə cahil olan kəsə ömrü boyu cahil demək mümkündür. Əlbəttə ki, bütün bunların nə qədər absurd olduğunu görmək çətin olmamalıdır.

Ona görə də bu absurd düşüncəni istifadə edərək ayədən məsumluğa dair dəlil çıxarmaq cəhdləri tamamilə əsassızdır. Bu dediklərimizi dəstəkləyən daha bir məqam budur ki, şiə alimlərinin özləri arasında bu dəlilin zəifliyini etiraf edənlər vardır. Misal üçün Muhəmməd Asif əl-Muhsini qeyd edir ki, imamların məsumluğuna dair Qurandan gətirilə biləcək iki dəlil vardır və bu ikisindən birinci olaraq bu ayəni qeyd edir. əl-Muhsini əlavə edir: "Lakin ayədən yəqinliklə bildiyimiz miqdar imamlar üçün məsumluğun yox, adilliyin isbatıdır."[225] Başqa cür desək ayədən çıxan aşkar məna budur ki, imamlıq məqamı üçün adil olmaq şərtdir, məsumluğun şərt olması isə ehtimal olaraq qalır. Çünki dediyimiz kimi zalımın əksi adil olmaqdır, məsum olmaq deyildir.

## Mubəhələ ayəsi

Daha bir dəlil olaraq şiələr "mubəhələ" ayəsini qeyd edirlər. Allah – taələ - buyurur: "Sənə bilik gəldikdən sonra kim səninlə (İsanın) barəsində mübahisə edərsə, de: "Gəlin oğullarımızı və oğullarınızı, qadınlarımızı və qadınlarınızı, özümüzü və özünüzü çağıraq, sonra isə dua edib yalançılara Allahın lənət etməsini diləyək". [3:61] Şiə alimləri mubəhələ ayəsini dəlil gətirib deyirlər ki, təfsirçilərin hamısı "oğulların" Həsən və Hüseynə, "qadınların" Fatiməyə, və "özümüzü" (*ənfusənə*) sözünün Əliyə işarə etdiyinə razılaşırlar. Peyğəmbərin zatı ilə Əlinin zatının eyni olduğunu demək mümkün olmadığı üçün burada mütləq "özünüzü" sözü ilə bərabərlik mənasının qəsd edilməsi lazımdır və Peyğəmbərin insanların ən yaxşısı olduğu heç bir şübhə doğurmadığı üçün Əlinin bərabərliyi də onun böyüklüyünə işarə edir. Məkarim əş-Şirazi yazır: "Mübahilə ayəsində '*özümüz*' ifadəsi İmam Əli ibn Əbu Talibi - aleyhissələm - nəzərdə tutur. Uca Peyğəmbər - salləllahu aleyhi va əlihi - əmisi oğlu İmam Əliyə -

[225] əl-Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/453;

aleyhissələm - '*özünü*' ifadəsi ilə müraciət etdikdə, burada məqsədi '*nəfs*' sözünün həqiqi mənasıdır, yoxsa məcazi və ya şərəfli bir mənadadır? Burada həqiqi mənanın nəzərdə tutulmadığı aydındır, çünki Əli, Peyğəmbərin özü deyil. Buna görə, burada məqsəd, İmam Əlinin - aleyhissələm - Uca Peyğəmbərin - salləllahu aleyhi va əlihi - sahib olduğu fəzilət və kamilliklərə, mənəvi məqamlara sahib olmasıdır. O, şücaət, müdriklik, cəsarət, təqva, fədakarlıq və digər mənəvi kamilliklərdə Peyğəmbər kimidir. Nəticə budur ki, İmam Əli - aleyhissələm - məqamlar və kamilliklər baxımından Peyğəmbər ilə - salləllahu aleyhi va əlihi - eyni məqamdadır və onun arxasınca gəlir. Bu məna ilə nəzərə alınaraq, aydın olur ki, Allah tərəfindən və ya İslam icması tərəfindən təyin edilməli olan Peyğəmbərin - salləllahu aleyhi va əlihi - xəlifəsi, bu məqamlara sahib olan və keyfiyyət və kamilliklər baxımından Peyğəmbərin misli olan və ya ona yaxın bir səviyyədə olan şəxsdir."[226] Bir digər şiə alimi İbrahim əl-Musəvi əz-Zəncani bunu yığcam şəkildə belə ifadə edir: "Bu (ayə) Əlinin - əleyhissəlam - imamətinin sabit olduğuna dəlalət edir, çünki Allah Təala onu Rəsulullahın - salləllahu aleyhi və alih - öz nəfsi etmişdir. Həqiqi mənada eynilik isə imkansız olduğu üçün, peyğəmbərlik məqamı istisna ümumi vilayətdə bərabərlik mənasın(ın qəsd olunması) qaçınılmazdır."[227]

Hər şeydən əvvəl qeyd etməyimiz lazımdır ki, bu deyilənlərin hamısının doğruluğunu qəbul etsək belə, yəni bunların doğruluğunu fərz etsək belə, yenə bu mübarək ayə heç kimin imamətini açıq şəkildə ifadə etmir, çünki müsəlmanların rəhbərliyi (*vilayət*) üçün imamda olmalı olan xüsusi qabiliyyətlər tələb olunur ki, o, ümməti sülh içində idarə edə bilsin və onun maraqlarına ən yaxşı şəkildə baxa bilsin. Mübarək ayə bununla bağlı heç bir şeyə işarə etmir, nə də xəlifəlikdən bəhs etmir. Əksinə, burada "oğullar", "qadınlar" və "özləri" deyildikdə peyğəmbərin iddiasının doğruluğunu sübut etmək üçün onlar qurbanlıq kontekstində xatırlanır. Bu şəxslər Peyğəmbərə qohumluq bağları baxımından ən yaxın olan insanlardır və bu səbəblə ən yaxınlarını *mubahələ* üçün təqdim edərək, onun iddiasının doğru olduğunu göstərir. Qurbanlıq konteksti və imamət mövzusu arasında böyük fərq var. Mubəhələ kontekstində qadınlar və uşaqlar irəli təqdim oluna bilər, lakin xəlifəlik üçün təqdim olunmazlar. Qadınların və uşaqların zikr

[226] əş-Şirazi, "Əyətul-Vilayə fil-Quran", səh: 161-162;

[227] əz-Zəncani, "Aqaid əl-İməmiyyə", səh: 85;

olunduğu belə bir məzmunda xəlifəlik və imamətdən söz gedə bilməz. Burada ortaya qoyula biləcək dəlil əlbəttə ki, əhlul-beytin fəzilətini isbat etmiş olur. Ona görə də Məkarim əş-Şirazi belə ayənin xilafətə dəlalət etdiyini demir, buna görə də xilafətlə əlaqələndirmək üçün xüsusi bir fəzilət isbat etməyə və oradan çıxış edərək imamət məsələsinə gətirməyə ehtiyac duyur. Həmçinin əş-Şərif əl-Murtəda bu ayənin müzakirəsində ayənin Əlinin fəzilətinə dəlalət etdiyini söyləyir və qısa müzakirə əsnasında yalnız bunu isbat etməyə çalışır. Müzakirəsi əsnasında heç yerdə ayənin Əlinin imamətinə dəlalət etdiyini söyləmir.[228]

Lakin İmam Əlinin - kərraməllahu vachəhu - Peyğəmbərə - salləllahu aleyhi va əlihi va səlləm - bərabər olduğunu və ya mərtəbə baxımından ona yaxın olduğunu iddia etmək, hətta İmamın özü tərəfindən qəbul edilməyən bir ifratdır (*ğulu*) və heç bir müsəlman bu fikri qəbul etməməlidir. Peyğəmbərin seçkin məqamı ilə onun hidayətindən və nurundan bəhrələnmiş bir başqasının məkanı eyni ola bilməz. Hətta əgər biz bu mübarək ayənin İmam Əlinin üstünlüyünü göstərdiyini desək, o zaman daha üstün (*əfzəl*) şəxs olduğu halda məqam baxımından daha aşağı olan (*məfzul*) kimsənin imaməti bəzi Şiə firqələri, məsələn, Zeydilər tərəfindən belə qəbul edilir. Bu nə şəriət, nə də ağılla qadağan edilmir, çünki məfzul imam ümumi olaraq fəzilət baxımından aşağı olsa da, xüsusi bir məsələdə daha üstün ola bilər; xəlifəlik və müsəlmanların rifahı ilə bağlı bəzi məsələlərdə daha yaxşı ola bilər. Peyğəmbərin özü - aleyhissalətu vassələm - daha yaxşı və daha fəzilətli olan biri olduğu halda, ən faydalı və ən münasib olanı təyin edərdi. Usamə bin Zeyd'in ordu başına əmir olaraq təyin olunması üzərində düşünən bir kəs bunun belə olduğunu anlayacaq.

Əhlüs-sünnət alimləri bu ayədən şiələrin çıxarmaq istədikləri mənanı anlamayıblar. Onlara görə ayədə "özümüzü" sözü ilə qəsd olunan "kişilərimizi" mənasıdır və məzmuna münasib olan da budur. "Yəni, dində və nəsəbdə öz cinsimizdən olan kişilərimizi çağırmağı qəsd edir və buradakı murad, iman ilə birlikdə qohumluqdakı təcanüsdür, beləliklə də qohumluq bağı olan övladları, qadınları və kişiləri zikr etmiş oldu və peyğəmbərin ata qohumlarında ona Əlidən daha yaxın olan biri yox idi." Mübahələ, yəni qarşılıqlı lənətləşmədə məqsəd insanın özünə ən yaxın olan insanları sözünün doğruluğuna

---

[228] əş-Şərif, "əş-Şəfi fil-İmamə", 2/264 (əd-Dirayəti təhqiqində 3/126)

girov qoyduğunu göstərməkdir, çünki ”insan təbiəti əcnəbilərdən çox, özünə ən yaxın olan qohumlara görə narahatlıq keçirir.”[229] Mubəhələ edən tərəflər iddialarında nə qədər əzm və qətiyyətlə doğru dediklərini isbat etmək üçün ən yaxın ailə üzvlərini fəda verməyə hazır olduqlarını göstərməlidirlər. Heç kəs şübhə etmir ki, nəsəb baxımından peyğəmbərə - salləllahu aleyhi va səlləm - ən yaxın olan övladları, nəvələridir, əmisi uşaqları arasından ən yaxın olan isə şübhəsiz Əli idi. Mötəzili alimlərdən əz-Zəməxşəri buyurur: “O, xüsusi olaraq oğullarını və qadınlarını gətirdi, çünki onlar ailənin ən dəyərli üzvləridir, ürəyə ən yaxın olanlardır. Bəzən insan onları qorumaq üçün özünü fəda edər və onlar uğrunda ölümə qədər mübarizə aparar. Buna görə də, müharibələrdə onlar qaçışın qarşısını almaq üçün qadınlarını özləri ilə gətirirdilər və onları həyatları ilə müdafiə edənlərə "həqiqətin müdafiəçiləri" deyilirdi.”[230] Bu baxımdan ayədə tələb olunan məna bütün mömin kişilər içindən seçim etməyi tələb etmir, lakin iman və qohumluq baxımından ən yaxın olan kəslərdən seçim etməyi tələb edir, ona görə də ayədə Əlinin - kərraməllahu vachəhu - ən fəzilətli olmasına dair dəlil yoxdur.

Burada üzərində durmalı olduğumuz daha bir nöqtə ayədəki “ənfusəkum” sözüdür. Bu söz həqiqətən də peyğəmbərlə - salləllahu aleyhi va səlləm - kamillik məqamında bərabərlik mənasına dəlalət edirmi? Quranın başqa ayələrdə bu sözü işlətməsinə yaxından nəzər saldığımızda görürük ki, Quranda heç bir yerdə bu sözlə statusda bərabərlik qəsd olunmayıb. Misal üçün Allah - azzə va cəllə - buyurur: “va lə təlmizu ənfusəkum…” [49:11] Yəni bir-birinizə tənə vurmayın! Mubəhələ ayəsinə şiələrin yanaşdıqları şəkildə bu ayəyə də yanaşmalı olsaq ortaya çıxan tərcümə belə olmalıdır: “Özünüzə tənə etməyin!” yaxud da “Özünüzə bərabər olanlara tənə etməyin!” Lakin aydındır ki, burada bu məna qəsd olunmur və şiə alimləri özləri də təfsirlərində bu cür izah etməyiblər. Misal üçün Şiə alimi əl-Muhəqqiq əl-Ərdəbili bu barədə yazır: “Sizin bir hissəniz digərlərinizi ayıblamasın, çünki möminlər bir can kimidir.”[231] Bunun eynisini Şeyx ət-Tusi “ət-Tibyən” təfsirində deyir.[232] Aydın olur ki, burada “özünüzə” sözü ilə qəsd olunan əslində “özünüzə” yox, “bir-birinizə” deməkdir. Həmçinin ət-Tabrasi deyir: “Yəni ki, sizdən bir hissəniz digər hissənizə tənə etməsin,

---

[229] əz-Zəhəbi, “əl-Muntəqa min Mənhəcil-İtidəl”, səh: 438; Muhibbuddin əl-Xatib nəşri

[230] əz-Zəməxşəri, “Təfsir əl-Kəşşəf”, 1/379;

[231] əl-Ərdəbili, “Zubdətul-Bəyan”, səh: 416;

[232] ət-Tusi, “ət-Tibyən”, 9/349;

necəki Allah-Təala buyurdu: '*Özünüzü öldürməyin*' [4:29], çünki möminlər bir bədən kimidirlər; sanki əgər bir mömin öz qardaşını öldürsə, elə bil özünü öldürmüş kimidir."[233] Ayədən, həmçinin ayəyə verilmiş izahlardan başa düşürük ki, burada Allah - cəllə va alə - "ənfusəkum" sözü ilə heç də onların hamısının nə fəzilət baxımından, nə bilik baxımından eyni olduqlarını qəsd etmir. Allah - subhənəhu va təalə - bir başqa ayədə buyurur: "Evlərə daxil olduğunuzda Allahdan olan mübarək və çox xoş salamla özünüzə salam verin!" [24:61] Şiə təfsir alimlərindən ət-Tabətabəi bu ayənin təfsirində buyurur: "Beləliklə, '*özünüzə salam verin*' ifadəsi evdə olan insanlara salam vermək mənasında istifadə olunur və '*özünüzə*' ifadəsi onların bir-birinin bir parçası olduğunu göstərmək üçün işlədilmişdir. Çünki hamısı insandır və Allah onları kişi və qadından yaratmışdır. İman onları qohumluqdan və hər hansı başqa bir şeydən daha güclü birləşdirir. '*Özünüzə salam verin*' ifadəsinin mənası, içəri girən şəxsin evdə olanlara salam verməsi və evdəkilərin də ona cavab olaraq salam verməsi kimi də başa düşülə bilər, bu da uzaq bir izah deyil."[234] Beləliklə də burada iki təfsir mümkündür; ya "özünüzə salam verin" deyildikdə ev əhlinə salam verin və ya ev əhli kişinin "özündən" sayılmışdır. ət-Tabətabəi'nin özünün də izah etdiyi kimi "onların bir-birinin parçası olduğunu göstərmək üçün" işlədilib. Lakin hamı anlayır ki, ev əhlinin kişinin "özündən" olması fəzilətdə, elmdə, bacarıqda və ya digər ölçülərdə evin böyüyü ilə eyni olmasını tələb etməz. Həmçinin Nur surəsində - "nə üçün siz bunu eşitdiyiniz zaman mömin kişilər və qadınlar özləri haqda yaxşı fikirdə olub: "Bu, açıq-aydın bir böhtandır!"– demədilər?"[24:12] ayəsində "bi ənfusihim xayran" sözləri keçməkdədir. Mömin kişilər və qadınlar özləri haqda niyə xeyir zənn etmədilər?! Əlbəttə ki, burada qəsd olunan hər kəsin özü haqda yaxşı zəndə olması deyildir, burada məqsəd mömin kişi və qadınların bir-biriləri haqqında xeyirli zəndə olmaqlarıdır. Ona görə də dilimizdəki tərcümələrdə ayə o şəkildə izah olunub. Həmçinin Şeyxut-Taifə ət-Tusi də təfsirində ayəni belə izah edir: "Kaş ki, siz bu iftiranı onu deyənlərdən eşidəndə, möminlər özləri kimi olan möminlər haqda yaxşı zənn etsəydilər. Çünki möminlərin hamısı başlarına gələn işlərdə bir can (nəfs) kimidirlər; onlardan birinin başına bir müsibət gəlsə, elə

[233] ət-Tabrasi, "Məcmə əl-Bəyan", 9/226;
[234] ət-Tabətabəi, Təfsir əl-Mizən", 15/165;

bil, bu müsibət onların hamısına gəlmiş olur. Bu da 'özünüzə salam verin' ayəsi kimidir."[235]

Üstəlik bu ayədəki "ənfusəkum" sözünü Əli bin Əbi Talibin kamillik məqamında peyğəmbərlə - salləllahu aleyhi va əlihi va səlləm - eyni olduğunu iddia etmək şiələr üçün bir başqa tərəfdən problem ortaya qoyur. Bu sözün gərəkdirdiyi məna o zaman budur ki, Həsən və Hüseyn, yəni əhlul-beytin ikinci və üçüncü imamları kamillik məqamında peyğəmbərlə - aleyhissələm - bir olmayıblar. Halbuki imamət inancına görə Həsənin və Hüseynin də bura daxil olması lazımdır, çünki onlar da imam məqamında olublar. Ayəni şiələrin anladığı kimi anlamaq daha bir problem ortaya çıxarır və problem budur ki, Əli - kərraməllahu vachəhu - Peyğəmbərin - sallələllahu aleyhi va səlləm - sağlığında möminlərin əmiri və imamı olmayıb. Ayənin imamətə dəlalət etdiyini iddia etmək Əlinin Peyğəmbərin - aleyhissələm - sağlığında imam olduğunu iddia etmək deməkdir və bu, şiələrin öz etiqadına görə batildir.

## Quranda İmam Anlayışı

Şübhəsiz ki, bizim bu məzmunda "imam" sözünün Allahın kitabında qazandığı mənalara nəzər salmasaq müzakirəmiz bəhrəsiz olacaq. Ona görə də bizim bu mərhələdə etməyimiz lazım olan məsələ Quranda imam məfhumunu yaxından incələməkdir. Gəlin birlikdə Quranda imam sözünün şiə məzhəbinə müvafiq bir mənada işlənib işlənmədiyini incələyək. Quranda Allah - cəllə cələluhu - "imam" sözünü birdən çox mənada işlədir. Bu sözün zikr olunduğu ayələrə nəzər salmalı olsaq görəcəyik ki, imam sözünü şiələrin başa düşdükləri şəkildə anlamaq üçün bir əsas yoxdur. Hər şeydən əvvəl başa düşməyimiz lazımdır ki, lüğəvi mənada "imam" sözü "tabe olunan", "nümunə götürülən" mənasındadır. ər-Rağib əl-İsfəhani deyir: "İmam – özünə tabe olunandır; istər sözünə və ya əməlinə tabe olunan insan olsun, istərsə də kitab və ya başqa bir şey olsun. Haqq və

235 ət-Tusi, "ət-Tibyən", 7/416;

ya batil əhli olması fərq etmir."[236] Bir sözlə "imam" sözü tabe olunan mənasındadır. Ona görə də namazda imam, məzhəb imamı, hansısa elmdə imam deyildikdə bunların hamısında öndə duran və tabe olunan bir şəxsiyyət qəsd olunur.

Quranda "imam" sözü on iki ayədə keçir. Bu ayələrə və ayələrdə bu sözün hansı mənada işləndiyinə yaxından baxmağımız məqsədimizə uyğundur. Birinci ayədə Allah - təbərakə va təalə - buyurur: "Əykə əhli də zalım idi. Onlardan da intiqam aldıq. Hər iki kənd aydın görünən yol (imam) üzərində yerləşirdi." [15:78-79] ət-Tabətabəi deyir: "Aydın bir imam üzərində yerləşirdi", yəni Lut qövmünün və Əykə əhlinin məskunlaşdığı yerlər açıq-aydın bir yolda yerləşir. Şam istiqamətində Mədinə yolunda yerləşənlər Lut qövmünün yurdudur."[237] Gördüyümüz kimi imam kəliməsini Quran burada "yol" mənasında işlədir. Bir başqa ayədə buyurur: "Həqiqətən, ölüləri diriIdən, onların (bu dünyada) törətdiklərini və tərk etdiklərini yazan Bizik. Biz hər şeyi açıq-aydın Imamda qeydə almışıq." [36:12] Şeyxut-Taifə ət-Tusi ayənin təfsirində deyir: "Və bunun mənası budur ki, biz bunu açıq-aydın bir kitabda saymışıq, yəni Lövhü-Məhfuzda. 'Aydın bir imam'da bunun qeyd olunmasının hikməti, mələklərin baş verən hadisələri onunla müqayisə edərək anlamalarıdır. Bu, həmçinin Allahın bütün məlumatları dəqiq və təfərrüatlı şəkildə bildiyinə dair bir dəlildir."[238] Bu ayədə isə əvvəlkindən fərqli olaraq imam sözü ilə kitab mənası qəsd olunub. Hər ikisini birləşdirən məna "tabe olunmaq" xüsusiyyətləridir, çünki mənzilə gedib çıxmaq üçün ora aparan yola tabe olmalısan. Kitaba gəldikdə isə ət-Tusi'nin izah etdiyi kimi mələklər hadisələri anlamaq üçün Kitaba tabe olurlar. İmamlar Quranda həmçinin hidayət rəhbərləri, hidayət liderləri və nümunələri mənasında işlənir. Quranda kitab üçün "imam" sözü başqa ayələrdə də işlədilmişdir. Misal üçün Musaya verilmiş Tövrat kitabına iki yerdə "imam" vəsfi verilib. Allah - cəllə cələluhu - Hud surəsində buyurur: "Rəbbindən açıq-aydın bir dəlilə əsaslanan, Allah tərəfindən bir şahidin (Cəbrailin) izlədiyi və ondan əvvəl Musanın rəhbər (imam) və rəhmət olan kitabının da şahidlik etdiyi kəs (başqaları kimi ola bilərmi)?" [11:17] Yenə bir başqa ayədə buyurur: "Bundan (Qurandan) əvvəl rəhbər (imam) və rəhmət olaraq

[236] əl-İsfəhani, "əl-Mufradət fi Ğarib əl-Quran", səh: 87;
[237] ət-Tabətabəi, Təfsir əl-Mizən", 12/185;
[238] ət-Tusi, "ət-Tibyən", 8/448;

Musanın kitabı vardı.” [46:12] Bu misallarda aşkar şəkildə göründüyü kimi insandan başqasının da imam olaraq vəsfi keçir.

İnsanlar da Quranda imamlar, yəni öndərlər və rəhbərlər olaraq zikr olunurlar. Bir ayədə Allah - təbarəkə va təalə - buyurur: “Onlar deyərlər: “Ey Rəbbimiz! Bizə gözümüzün aydınlığı olan zövcələr və övladlar bəxş et və bizi müttəqilərə imam et!” [25:74] Şiə təfsir alimi ət-Tabrasi bunun təfsirində deyir: “Bizi müttəqilərin bizə tabe olduğu kimsələrdən et. Onlar izzəti dünya ilə deyil, təqva ilə əldə etməyi istədilər. Başqa bir şərhə görə, bunun mənası belədir: Bizi bizdən əvvəlkilərə tabe olmağa yönəlt ki, bizdən sonrakılar da bizə tabe olsunlar.”[239] ət-Tusi bu ayə haqqında deyir: “Onların 'Və bizi müttəqilərə imam et' sözünün mənası budur ki, onlar Uca Allahdan onları itaətdə əməllərinə tabe olunan kimsələrdən etməsini diləyirlər.”[240] Allah - azzə va cəllə - buyurur: “Səbr etdiklərinə və ayələrimizə yəqinliklə inandıqlarına görə Biz əmrimizlə onlardan doğru yolu göstərən rəhbərlər (imamlar) təyin etmişdik.” [32:24] ət-Tabrasi deyir: “Biz əmrimizlə onlardan doğru yolu göstərən rəhbərlər (imamlar) təyin etmişdik." – yəni, onları xeyir işlərdə başçı etdik, belə ki, onlara tabe olunurdu və onlar Allahın izni ilə insanları xeyir işlərə yönəldirdilər. Digər bir izahda isə deyilmişdir ki, onlar peyğəmbərlərdir, həmin ümmət içərisində insanlara Allahın əmri ilə doğru yolu göstərirdilər. "Onlar səbir etdikləri üçün" – yəni, onların səbr etməsi səbəbindən biz onları imam etdik.”[241] Daha bir ayədə deyir: “Biz Öz hökmümüzlə onları doğru yolu göstərən (hidayət edən) rəhbərlər (imamlar) etdik. Onlara xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi vəhy etdik. Onlar yalnız Bizə ibadət edirdilər.”[21:73] Şiə təfsir alimləri yenə eyni məna ilə təfsir edirlər. ət-Tabrasi deyir: ““Və Biz onları imamlar etdik” – yəni, onların söz və əməllərində başqaları onlara tabe olur, onlara iqtida edirlər. “Doğru yol göstərirlər”, yəni onlar insanları haqq yoluna və düz dinə hidayət edirlər.”[242] Yenə buyurur: “Biz o torpaqlarda əzilənlərə (İsrail oğullarına) lütf edərək, onları rəhbərlər (imamlar) və varislər etmək istəyirdik.”[28:5] ət-Tabətabəi buyurur: “Məna budur: o dövr – Fironun qüdrətləndiyi, insanları parçaladığı və İsrail oğullarını hər bir baxımdan zəif salaraq onları yox etməyə və məhv etməyə çalışdığı bir dövr idi. Bu halda isə

---

[239] ət-Tabrasi, “Məcmə əl-Bəyan”, 7/316;

[240] ət-Tusi, “ət-Tibyən”, 7/512;

[241] ət-Tabrasi, “Məcmə əl-Bəyan”, 8/521

[242] Eyni mənbə, 7/101;

Biz – hər tərəfdən zəif salınmış bu insanlara ağır və böyük bir nemət bəxş etmək istədik. Bu isə, onları nümunə götürülən imamlar etmək idi, beləliklə də onlar tabe olunanlar olacaqdılar, halbuki əvvəllər onlar başqalarına tabe idilər; və əvvəllər başqalarının əlində olan şeylər onlara çatsın deyə onları varislər etmək və onlara istiqrar tapacaqları bir məkan verməklə onları Yer üzündə möhkəmləndirmək idi. Beləliklə də əvvəllər onların öz iradələri ilə deyil, başqalarının istədiyi yerlərdə yerləşdikləri halda, indi onların özlərinin sahib olduğu və sabit dayandıqları yerləri olsun; və Firona – Misirin padşahına, və onun vəziri Haman'a, və onların ordularına – bu əvvəl zəif salınmış şəxslər tərəfindən qorxduqları şeyi göstərək; yəni onların üstün gəlib hakimiyyəti, malı və yollarını (siyasətlərini) əllərindən almalarını göstərək."[243] ət-Tusi də qısa şəkildə deyir: "Və onları rəhbərlər (imamlar) edək — yəni, onlara tabe olunsun, onların ardınca gedilsin. Və onları varislər edək — yəni, onlardan əvvəlki Firon qövmünün yerinə keçsinlər, onların malik olduqlarına varis olsunlar."[244]

Eyni şəkildə cəhənnəmə dəvət edən imamlar da olub. "Biz onları oda çağıran rəhbərlər etdik. Qiyamət günü onlara kömək edilməyəcəkdir." [28:41] ət-Tabətabəi deyir: "Cəhənnəmə çağırış – bu, küfr və günahlar vasitəsilə cəhənnəmə aparan şeylərə dəvətdir. Çünki həmin küfr və günahlar Qiyamət günü onlara əzab veriləcək cəhənnəm kimi təsəvvür olunur. Və ya "cəhənnəm"dən məqsəd, onu vacib edən şeylərdir; bu da səbəbin adı ilə nəticənin nəzərdə tutulduğu məcazi ifadədir. Onların cəhənnəmə çağıran imamlar kimi göstərilməsinin mənası budur: onlar azğınlıqda qabaqcıl oldular və sonrakılar da onlara tabe oldular. Bu isə onların küfr və inkar baxımından öncül olmalarının əvəzi olaraq onlara verilmiş bir ünvandır, yoxsa burada ilkin bir azdırma mənası yoxdur."[245] Cəhənnəmə dəvət edən imamlar sözündən başa düşürük ki, Quranda imam sözü xüsusi şəri bir mənada işlənmir. Bir başqa ayədə də buyurur: "Əgər müqavilə bağladıqdan sonra andlarını pozar və dininizi təhqir edərlərsə, küfrün öndərləri (küfr imamları) ilə vuruşun! Həqiqətən, onlar andları olmayan (andlarını pozan) kimsələrdir. (Onlarla vuruşsanız,) Ola bilsin ki, onlar (bu etdiklərinə) son qoyarlar."[246] [9:12] Ayədə Allah - cəllə cəlaluhu - Məkkə müşriklərinin

---

[243] ət-Tabətabəi, "Təfsirul-Mizən", 16/9;

[244] ət-Tusi, "Təfsirut-Tibyən", 8/129;

[245] ət-Tabətabəi, "Təfsirul-Mizən", 16/38;

[246] Şiə rəvayət və təfsir kitablarında bu ayədəki "küfr imamları" ilə qəsd olunanların Cəməl əhli, yəni Aişə, Talha və Zubeyr kimi səhabələrin olduğuna dair xəbərlər gəlir. Sanki Allah

öndərlərini küfr imamları adlandırmışdır. ət-Tabrasi deyir: "Yəni: küfr və azğınlıq başçıları – rəhbərləri. Allah onları döyüşməklə xüsusi olaraq əmr etmişdir, çünki onlar ardıcıllarını azğınlığa sürükləyirlər."[247] ət-Tusi də eyni şəkildə buyurur: "Onun "Küfr başçıları ilə vuruşun" (ayəsi) – Allah-Təalanın küfr başçıları ilə döyüşməyi əmr etməsidir. Onlar isə azğınlığın və kafirlərin rəhbərləri – öndə gedənləridir. "İmam" – ardıcıl olanların önündə gedən şəxsə deyilir. Küfr imamları – küfr və azğınlığın başçılarıdır. Xeyirdə olan imam – doğru yolda olan və başqalarına doğru yolu göstərən şəxsdir. Şərdə olan imam isə – azmış və başqalarını da azdırandır."[248]

Buraya qədər saydıqlarımız arasında anlaşılmalı çətin olan heç bir ayə ilə qarşılaşmadıq. Geriyə qalan iki ayə isə üzərində daha çox müzakirə aparılmış ayələrdir. Bunlardan biri daha əvvəl müzakirəsini etdiyimiz İbrahimin imamlığı ayəsidir və orada bununla bağlı kifayət qədər məlumat verdik, ona görə də burada təkrara ehtiyac yoxdur. Qısa şəkildə deyə bilərik ki, İbrahim peyğəmbərin imam edilməsi onun bütün bəşəriyyət üçün "tövhid rəhbəri" olmasıdır. Sonuncu ayə isə Allahın - azzə va cəllə - bu sözləridir: "O gün bütün insanları imamları ilə birlikdə çağıracağıq. Əməl dəftəri sağ tərəfindən verilənlər öz əməl dəftərlərini oxuyacaq və onlar cüzi bir haqsızlığa belə məruz qalmayacaqlar." [17:71] Bu ayədəki "imam" ilə muradın nə olmasında alimlər ixtilaf ediblər. Burada "imam" sözünə verilmiş təfsirlərdən biri budur ki, qəsd olunan əməl dəftərləridir, yəni mələklərin onların əməllərini yazdıqları kitablardır. Bu, İbn Abbas, əd-Dahhək, əl-Həsən əl-Basri, Əbul-Aliyə, İbn Quteybə, Əbu Bəkr əl-Ənbəri, Əbu Bəkr əl-Uzeyri və başqalarının rəyidir.[249] Digər təfsirə görə qəsd olunan peyğəmbərlərdir, yəni hər bir qövm öz peyğəmbəri ilə çağırılacaq. Bu rəy Qatədə və Mücahid'dən sabitdir.[250] Əbu Ubeyd Muammər bin əl-

---

bu ayəni endirdikdə Məkkədəki küfr, zəlalət və şirk imamlarına qarşı yox, məhz Cəməl əhlinə qarşı vuruşmağı əmr etdi. Bunun nə dərəcədə absurd bir iddia olduğunu göstərmək üçün üzərində çox dayanmağa ehtiyac yoxdur, çünki hər şeydən əvvəl ayənin nazil olma səbəbi var. İkincisi isə ayə Allahın elçisinin - salləllahu aleyhi va səlləm - zamanında sağ olan müsəlmanlara xitabdır və onlara əmrdir.

[247] ət-Tabrasi, "Məcmə əl-Bəyan", 5/21;

[248] ət-Tusi, "Təfsirut-Tibyən", 5/183;

[249] "Təfsir Yəhya bin Səlləm", 1/150; "Təfsir Abdirrazzəq", 2/305 (1594); İbn Quteybə, "Şərh Muşkil əl-Quran", səh: 254; Təfsir ət-Tabəri", 15/7-8 (ət-Turki təhqiqi); əl-Ənbəri, "əz-Zəhir", 2/19; əl-Uzeyri, "Ğaribul-Quran", səh: 99;

[250] "Təfsir Yəhya bin Səlləm", 1/150; "Təfsir Abdirrazzəq", 2/305 (1593); "Təfsir ət-Tabəri", 15/6 (ət-Turki təhqiqi);

Musənnə əl-Basri isə deyir ki, burada qəsd olunan sözün lüğəvi mənasıdır; yəni hər kəs bu dünyada kimi özünə rəhbər və öndər seçmişdisə onunla çağırılacaqlar. Əlavə edir ki, buradakı mənanın "kitabları ilə çağırılacaqlar" olması da mümkündür.[251] Daha bir təfsir isə budur ki, hər bir qövm bu dünyada onlara endirilmiş kitab ilə çağırılacaqlar, yəni misal üçün yəhudilər Tövrat ilə, müsəlmanlar Quran ilə çağırılacaqlar. ət-Təbəri təfsirində bunu İbn Zeydə nisbət edir.[252] Bu sonuncu rəy həm də əz-Zəccac'ın rəyidir.[253] Təfsir kitablarının əksərində bu rəylər mücməl şəkildə təqdim olunur və bunların hamısı ehtimal olunur. Lakin qeyd etməyimiz lazımdır ki, burada imam ilə xüsusilikdə "peyğəmbərlər" və ya "ilahi kitablar" qəsd oluna bilməz, çünki ayədən anlaşıldığı kimi hər kəsin öz imamı olacaq; məlumdur ki, peyğəmbərlərə və kitablara inanmayan, onları qəbul etməyən insanlar da olacaq. O zaman burada ayənin zahirinə uyğun olan iki təfsir mümkündür. Ya əməl dəftərləri qəsd olunur, ya da bu dünyada tabe olduqları kəslər və şeylər qəsd olunur. Şiə təfsir kitablarında da bu müxtəlif rəylərə olduğu kimi yer verilir. Misal üçün ət-Tusi deyir: "Onlar Qiyamət günü öz imamları ilə çağırılacaqlar – ayəsinin təfsirində alimlər ixtilaf ediblər: Mücahid və Qətadə demişlər: Buradakı "imam"dan məqsəd, hər kəsin peyğəmbəridir. İbn Abbas isə demişdir: Onların imamı – öyrəndikləri elm kitabıdır. Ondan həmçinin bu da rəvayət olunmuşdur ki, onların imamı – Allahın onlara göndərdiyi və içində halal-haram, vacibat və hökmlər olan kitabdır. əl-Bəlxi demişdir: Onların imamı – dünyada ibadət etdikləri və imam qəbul etdikləri şeylərdir. Əbu Ubeyd isə demişdir: Onların imamı – dünyada tabe olduqları, arxasınca getdikləri şeylərdir. Bu sonuncu görüş Əbu Cəfər'in və Əbu Abdullah'ın - əleyhimassəlam - rəyidir."[254] Bu sonuncu rəy həmçinin İbn Cərir ət-Təbəri'nin tərcih etdiyi rəydir. İbn Kəsir isə bunun əməl dəftəri olması rəyini tərcih etmişdir.[255] ən-Nəhhas, əl-Beydavi, ən-Nəsəfi kimi təfsir alimləri isə bu izahların hamısını doğru qəbul edirlər və deyirlər ki, bunların hamısı imamdır; elə bir qövm olacaq ki, peyğəmbərləri ilə çağırılacaqlar, kitabları ilə çağırılanlar da olacaqlar, bu dünyada tabe olduqları rəhbərləri ilə də çağırılanlar olacaq. İstənilən halda bu ayədə də şiələrin etiqad etdikləri

---

[251] Əbu Ubeyd, "Məcəzul-Quran", 1/386;

[252] Təfsir ət-Təbəri", 15/8;

[253] əz-Zəccac, "Məanil-Quran va İrabuhu", 3/252-253;

[254] ət-Tusi, "Təfsirut-Tibyən", 6/504;

[255] "Təfsir İbn Kəsir", 9/47 (Əvladuş-Şeyx)

“imam” məfhumu qəsd olunmur. Şiə təfsir alimi ət-Tabətabəi bu həqiqəti belə izah edir: “Onun “imamları ilə” (ifadəsi) qeydsiz şəkildə gəlmişdir; yəni, Allahın əmr ilə hidayət etmək üçün imam təyin etdiyi haqq imamla məhdudlaşdırılmamışdır. Allah necə ki hidayət rəhbərini "imam" adlandırmışdır, eləcə də azğınlığa aparan rəhbəri də "imam" adlandırmışdır. Ayetin sonundakı kontekst və ikinci ayənin gedişatı da göstərir ki, Qiyamət günü insanlara tərəflərindən bu dünyada imam qəbul edib ardınca getdikləri kəslərlə çağırılacaqlar. Bu, Allahın imamlıq üçün seçdiyi və hidayət üçün təyin etdiyi kəslər olması şərt deyil – istər insanlar onu qəbul etmiş olsun, istərsə də rədd etmiş olsunlar. Beləliklə, ayədə “hər bir camaatın imamı” dedikdə, onların dünyada arxasınca getdikləri şəxs nəzərdə tutulur – istər haqq imam, istərsə də batil imam olsun.”[256]

Şiələrin nəzərdə tutduqları mənada “imam” konseptini təmsil edəcək heç bir mənanın Quranda zikri keçmir. Məsumluq, elm, ilahi irşad və mənəvi və siyasi liderlik kimi vəsfləri özündə cəm edən xüsusi bir söz keçməməkdədir. Siyasi lider, dövlət başçısı, məmləkət idarə edən səltənət sahibi üçün Quranın işlətdiyi sözlər ya xəlifə, ya da məlik sözüdür. Quranda Allah - cəllə cəlaluhu - insan cəmiyyətini və siyasi bir quruluşu hüquqi və şəri avtoritet ilə idarə etmək haqqını “mülk” adlandırmışdır. O, İsrail oğullarının qurduqları idarə strukturlarına rəhbərlik etmiş Musa, Talut, Davud və Süleyman kimi şəxslərə “mülk” vermişdir. Ibrahim peyğəmbərin - aleyhissələm - soyunda ilk mülk verilmiş şəxs Yusuf peyğəmbər olub və onu Allah - təalə - Misir torpaqlarına hökm sahibi etdi. Yusuf peyğəmbər duasında deyir: “Ey Rəbbim! Sən mənə hakimiyyət (mülk) verdin və mənə yuxuları yozmağı öyrətdin.” [12:101] Ondan sonra İsrail oğulları Misir torpaqlarında kölələşdirilirlər. Musa peyğəmbərin gəlişinə qədər onlar kölə olaraq qalırlar və Musa peyğəmbər gəlib onları kölələlikdən azad etdikdə onların arasında Allahın ona verdiyi şəriət ilə hökm etdi. Ona görə də Allah - təbərakə va təalə - buyurur: “O zaman Musa öz qövmünə demişdi: “Ey qövmüm! Allahın sizə olan nemətini xatırlayın. O, sizin aranızdan peyğəmbərlər göndərdi, sizi hökmdarlar (muluk) təyin etdi və aləmlərdən heç kəsə vermədiyini sizə verdi.” [5:20] Musadan sonra Kənan torpaqlarına yerləşən yəhudilər orada parçalanmış şəkildə yaşayırdılar və hücumlara məruz qalırdılar. Allah Quranda onların istədiklərini xatılardır: “Musadan sonra İsrail oğullarından bir dəstəni

[256] ət-Tabətabəi, “Təfzirul-Mizan”, 13/166;

görmədinmi?! Onlar öz peyğəmbərlərinə demişdilər: “Bizə bir hökmdar (məlik) göndər ki, (onun rəhbərliyində) Allah yolunda vuruşaq!” O da: “Vuruşmaq sizə əmr olunduğu zaman bəlkə vuruşmadınız?!” - dedi. Onlar: “Bizə nə olub ki, Allah yolunda vuruşmayaq. Yurdumuzdan çıxarılmışıq və övladlarımızdan (ayrı düşmüşük)”, - dedilər. Vuruşmaq onlara vacib edilən zaman onlardan az bir qismi istisna olmaqla, (döyüşdən) üz çevirdilər. Allah zalımları çox yaxşı tanıyır. Peyğəmbərləri onlara dedi: “Allah Talutu sizə hökmdar (məlik) göndərdi”. Onlar belə dedilər: “Onun üzərimizdə necə hökmdarlığı (mülk) ola bilər? Axı, biz hökmdarlığa (mülk) ondan daha layiqik. Ona çoxlu mal-mülk də verilməyib”. O (Peyğəmbər) dedi: “Həqiqətən, Allah sizin üçün onu seçdi, elm və bədəncə gücləndirdi. Allah Öz hökmranlığını (mülk) dilədiyinə verər. Allah (lütfü ilə) genişdir, hər şeyi biləndir!” [2:246-247] Talut’dan sonra Davudu zikr etdikdə buyurur: “Davud da Calutu öldürdü. Allah Davuda hökmranlıq (mülk) və hikmət verdi və ona istədiyini öyrətdi.” [2:251] Bir başqa ayədə Davud peyğəmbəri qəsd edərək buyurur: “Biz onun mülkünü möhkəmləndirdik, özünə də hikmət (peyğəmbərlik) və düzgün qərar çıxartmaq qabiliyyəti bəxş etdik.” [38:20] Davud peyğəmbərdən sonra israillilərin başına keçən Süleyman peyğəmbər oldu. Onun haqqında Allah buyurur: “Onlar Süleymanın hökmranlığına (mülk) dair şeytanların oxuduqlarına uydular.” [2:102] Süleyman peyğəmbər - aleyhissələm - Allahdan insanlar üzərində rəhbərlik və idarə istədikdə də məhz bu sözü işlədərək belə dua etmişdi: “O dedi: “Ey Rəbbim! Məni bağışla və mənə elə bir səltənət (mülk) ver ki, məndən sonra heç kimə nəsib olmasın. Həqiqətən, Sən Bəxşedənsən.” [38:35] Beləliklə də Allah bizə israillilərin başında hökmdarlıq etmiş peyğəmbərlərə verdiyinin “mülk” olduğunu xəbər verir. Ona görə də bir ayədə Ibrahim peyğəmbərin soyundan çıxardığı bu peyğəmbərləri və hökmdarları xatırladaraq buyurur: “Yoxsa onlar Allahın Öz lütfündən bəxş etdiyi şeylərə görə insanlara həsədmi aparırlar? Halbuki, Biz İbrahim ailəsinə kitab və hikmət vermiş, onlara böyük bir hökmranlıq (mülk) bəxş etmişdik.” [4:54]

Qeyd etməliyik ki, “mülk” sözü sadəcə olaraq siyasi idarə və hakimiyyət mənalarını ifadə edir və bu sözün içində “məsumluq” və ya “fəzilət” mənaları yoxdur. Çünki Quran bizə xəbər verir ki, Allah mülkünü bəzən kafirlərə də verir. Yusuf peyğəmbərin - aleyhissələm - zamanındakı Misirin hakimini Allah - təalə - “məlik” adlandırır, onun Misirin hökmdarı olduğunu təsdiq edir. “Padşah (məlik) dedi: “Mən

(yuxuda) yeddi arıq inəyin yeddi kök inəyi yediyini, həmçinin yeddi yaşıl sünbül və bir o qədər də qurusunu gördüm. Ey zadəganlar! Əgər yuxu yoza bilirsinizsə, yuxumun yozumunu mənə bildirin". [12:43] "Padşah (məlik) dedi: "Onu yanıma gətirin!" Elçi onun yanına gəldikdə (Yusuf) dedi: "Ağanın yanına qayıt və soruş gör ki, əllərini doğrayan qadınların məq--sədi nə idi? Şübhəsiz ki, Rəbbim onların hiyləsini bilir"." [12:50] Yenə eyni padşahdan söz açaraq deyir: "Onlar dedilər: "Padşahın (məlik) piyaləsini itirmişik. Onu gətirənə bir dəvə yükü (ərzaq) veriləcək". (Carçı): "Mən buna zaminəm!"– (dedi)." [12:72] "O, qardaşının yükündən əvvəl onların yüklərini (axtarmağa) başladı, sonra da piyaləni qardaşının yükündən çıxartdı. Biz Yusufa belə bir tədbir öyrətdik. Yoxsa padşahın qanunlarına görə, o, qardaşını tutub (öz yanında) saxlaya bilməzdi. Allahın istəyi isə istisnadır. Biz istədiyimiz kəsi dərəcə-dərəcə yüksəldirik. Hər bilik sahibindən də üstün bir bilən vardır." [12:76] Süleyman peyğəmbərə xitabında isə Hüdhüd ona Səba kraliçasının xəbərini verərək deyir: "Mən onlara padşahlıq (təmlikuhum) edən, özünə hər şey verilmiş və çox böyük bir taxtı olan bir qadın gördüm. Mən onun və tayfasının Allahı qoyub günəşə səcdə etdiklərinin şahidi oldum. Şeytan onların əməllərini özlərinə gözəl göstərmiş və onları (haqq) yoldan çıxartdığına görə haqqın yolunu tapa bilmirlər." [27:23-24] Səba kraliçası Bəlqis'in sözlərini Allah bizə belə xəbər verir: "Dedi: Hökmdarlar (muluk) hər hansı bir məmləkətə soxulduqları zaman onu viran qoyar, xalqının hörmətli adamlarını da zəlil edərlər. Onlar bax belə edərlər." [27:34] Misirin Fironu da misirlilər üzərində mülkə sahib idi. Onun sarayında imanını gizli saxlayanlardan biri misirlilərə xitab edərək demişdi: "Ey qövmüm! Bu gün hökm (mülk) sizindir. Yer üzündə qalib olanlar da sizsiniz. Əgər bizə Allahın əzabı gəlsə, ona qarşı kim bizə kömək edə bilər?!" [40:29] Ibrahim peyğəmbərin Nəmrud ilə müzakirəsini bizə xatırladaraq buyurur: "Allahın verdiyi hakimiyyətə (mülk) görə İbrahim ilə Rəbbi barəsində höcətləşən kəsin (əhvalatını) bilmirsənmi? İbrahim: "Mənim Rəbbim həm dirildir, həm də öldürür!"– dedikdə (padşah): "Mən də həm dirildir, həm də öldürürəm!"– demişdi. İbrahim: "Allah günəşi məşriqdən gətirir. Sən də onu məğribdən gətir!"– dedikdə, o kafir çaşıb qalmışdı. Allah zalım qövmü doğru yola yönəltməz." [2:258]

Xəlifə sözünə gəldikdə isə Quranda yalnız bir yerdə aşkar hökmdarlıq məzmununda işlənmişdir. Allah peyğəmbəri Davuda xitabında buyurur: "Ey Davud! Biz səni yer üzündə xəlifə təyin etdik. Elə isə insanlar arasında ədalətlə hökm ver, nəfsin istəyinə uyma, yoxsa

o səni Allahın yolundan azdırar. Həqiqətən, Allahın yolundan azanları Hesablaşma gününü unutduqları üçün şiddətli bir əzab gözləyir." [38:26] Lakin diqqət çəkmək lazımdır ki, mülk sözü zülm və ədalətlə idarə edənlər üçün bərabər şəkildə işləndiyi halda "xəlifə" sözü özlüyündə bir vəzifə və məsuliyyət mənası daşıyır. Ona görə də hər idarə edənə "Allahın xəlifəsi" demək doğru olmaz, yalnız ədalət ilə idarə edənlərə Allahın xəlifəsi demək doğrudur. Beləliklə də Quranda keçən imam və xəlifə sözləri arasında açıq-aşkar bir fərq vardır. ər-Rağib əl-İsfəhani bununla bağlı deyir: "(İmam sözü) Şəriətin istifadəsində tabe olunan, şəriətə əsasən tabe olunan şəxsə verilmiş bir addır. Bu isə peyğəmbər və xəlifədən daha ümumi bir məna daşıyır, çünki hər bir peyğəmbər və xəlifə imamdı, lakin hər bir imam və peyğəmbər xəlifə deyildir. Sözlər (kəlimələr) bəzən tərtib olunmuş ifadələrə, bəzən də həmin ifadələrin daşıdığı mənalara işarə etmək üçün işlədilə bilər."[257]

## İmamət və Quranın təhrifi

Bura qədər təqdim etdiklərimizdən anlaşılır ki, Quranda imamət inancı ilə bağlı açıq-aşkar bir dəlil yoxdur. Qarşıya qoyulan dəlillər isə ən yaxşı halda - Şeyxut-Taifə ət-Tusi'nin vəsf etdiyi kimi - tapmaca şəklində gizli olan mənanı üzə çıxarmaqdan ibarətdir. Ona görə də şiələrdə erkən zamandan bununla bağlı bir rahatsızlıq olub və suallar yaranıb. Əlbəttə ki, bu cür suallar qarşısında səssiz qalmaq siravi şiələrin öz inanclarında şübhəyə düşməklərinə səbəb olacaqdı. Beləliklə də bu suallara cavab olaraq Quranla bağlı yeni bir təsəvvür formalaşmağa başladı. Bu təsəvvür tədricən yeni bir libasa büründü və şiə kitablarında rəvayətlər olaraq ortaya çıxdı. Bu yeni nəzəriyyəyə görə Quranda "imamət" inancının olmamasının səbəbi Quranın təhrif edilmiş olması idi. Bu fikrin erkən bir zamanda ortaya çıxmasını biz şiə rəvayətlərində müşahidə edirik. əl-Qadi Abdulcəbbər kitablarında bir yerdə rafizilərin ən erkən ravilərindən olan Hişəm bin əl-Həkəm haqqında danışarkən deyir: "O, Qurana əlavənin olduğunu və orada

[257] "Təfsir ər-Rağib əl-İsfəhani", 1/309; Tanta Universiteti, 1999

naqisliyin olduğunu deyərək insanları Qurana şəkk etdirirdi…”[258] Şiə kitablarındakı xəbərləri yaxın incələdikdə görürük ki, belə bir etiqad İbn əl-Həkəm’in zamanında yayğın bir etiqad idi. Ona görə də bu gün bəzi şiə alimlərinin mənəvi mütəvatir olduğunu iddia etdiyi xəbərləri də məhz buna etiqad edən şiələr öz məclislərində dövriyəyə buraxıblar.

Üstəlik şiələr bu barədə ayrıca kitablar da ortaya qoyublar. Bunların içində bizim zamanımıza qədər gəlib çatmış ən qədim kitab hicri üçüncü əsrdə yaşamış, onuncu və on birinci imamın əshabından sayılan Əhməd bin Muhəmməd əs-Səyyəri’nin “əl-Qiraət” kitabıdır. Mirzə Hüseyn ən-Nuri öz zamanında Quranın təhrif edilmiş olduğunu isbat etmək üçün yazdığı “Fəslul-Xitab” kitabında yoğun bir şəkildə əs-Səyyəri’nin kitabına əsaslanıb. Bu inkar olunmaz bir faktdır ki, şiə məzhəbində Quranın təhrifinə inanmış alimlər və ciddi bir təqlidçi kütləsi hər zaman olub. əl-Feyd əl-Kəşəni yazır: “Əhl-Beyt yolu ilə gəlmiş xəbərlərdən və digər rəvayətlərdən ortaya çıxan yekun məna budur ki, əlimizin altında olan Quran, (peyğəmbər) Muhamməmdə nazil olunduğu kimi tam versiya deyildir; orada elə şey vardır ki, Allahın endirdiyinə müxalifdir. Elə şey vardır ki, dəyişdirilib, təhrif edilib. Oradan çox şey çıxarılıb; misal üçün çox yerdə Əlinin adı düşürülüb. Bundan başqa təhriflər də vardır. Həmçinin Allah və elçisinin razı olmadığı bir şəkildə tərtib olunub.”[259] Şiələrin əxbari qolunda daha çox yayğın olan bu inanc siravi şiələrin beynində əmələ gəlmiş suallara cavab olaraq formalaşmış rəvayətlərə əsaslanır. Bu rəvayətlərlə qısa bir şəkildə tanış olmaqda fayda vardır, çünki görəcəyimiz kimi bu rəvayətlərdə Quranın ayələri “imamət inancına” uyğun şəkildə təhrif olunur, sanki “səhabələrin ayələrə daxil etdikləri əyriliklər” bu rəvayətlərdə düzəldilir.

Bu rəvayətlərin birində Bureydə bin Müaviyə deyir ki, Əbu Cəfər - aleyhissəlam - ayəni belə oxudu: "Allaha itaət edin, Rəsula itaət edin və sizdən olan əmr sahiblərinə (itaət edin). Əgər bir işdə ixtilafa düşsəniz, onu Allaha, Rəsula və sizdən olan əmr sahiblərinə qaytarın". Sonra buyurdu: "Bu şəkildə nazil olub. Necə ola bilər ki, Allah onlara itaəti əmr etsin, sonra isə onlarla münaqişəyə icazə versin?! Şübhəsiz ki, bu, ancaq itaət etmələri əmr olunanlar barəsində deyilmişdir, onlara deyilmişdir ki: "Allaha itaət edin, Rəsula itaət edin…"[260] Bu xəbərdə

---

[258] “Fədlul-İtizal va Tabəqat əl-Mutəzilə”, səh: 104; Darul-Fərabi, Beyrut, 1439

[259] əl-Kəşəni, “ət-Təfsir əs-Safi”, 1/49;

[260] əl-Kuleyni, “əl-Kəfi”, 1/276;

İmama nisbət edilən sözlərdən anlaşılır ki, Quranın bu gün oxuduğumuz şəklində problem yaranıb, çünki bu gün oxuduğumuz ayədə ixtilaf halında yalnız iki məqama, Allaha və Rasuluna qaytarmaq əmr olunur, əmr sahiblərinə qaytarmaq əmri yoxdur. Bu rəvayət, problemi həll etmək üçün ayədə təhrifin olduğunu iddia etməli olur. Halbuki ayənin ümumiyyətlə mövzu ilə yaxından-uzaqdan heç bir əlaqəsi yoxdur. Hədisi şərh edən şiə alimi əl-Məzəndərani özü belə etiraf etməli olur ki, "zahir olan budur ki, ayə İsrail oğurlarının məzəmməti üçün nazil olub..."[261]

Əbu Bəsir deyir ki, İmam Cəfər əs-Sadiq Əhzab surəsindəki 70-ci ayəni belə oxudu: "Kim Allaha və Onun Elçisinə Əlinin vilayətində və ondan sonrakı imamların vilayətində itaət etsə, böyük bir uğur qazanar." Sonra dedi: "Bu cür nazil olub."[262] əl-Məzəndərani təsdiq edir ki, rəvayətin "zahiri budur ki, ayə ləfz olaraq bu cür nazil olmuşdu və təhrif əlləri onu dəyişdirib..."[263] Əbu Həmzə deyir ki, Əbu Cəfər - aleyhissələm - buyurdu: "Cəbrail – aleyhissəlam – bu ayəni bu şəkildə nazil etdi: "Şübhəsiz ki, Muhəmmədin ailəsinin haqlarına zülm edənləri Allah nə bağışlayar, nə də onlara başqa bir yol göstərər – içində əbədi qalacaqları cəhənnəm yolundan başqa. Bu isə Allah üçün asandır." Sonra dedi: "Ey insanlar! Peyğəmbər sizə Rəbbinizdən Əlinin vilayəti ilə bağlı haqqı çatdırdı. (Ona) iman gətirin! (Bu) sizin üçün xeyirli olar. Əgər Əlinin vilayətini inkar etsəniz, şübhəsiz ki, göylərdə və yerdə nə varsa, Allaha məxsusdur."[264] Quranda bugün bu ayələri belə oxuyuruq: "Şübhəsiz ki, kafir olub zülm edənləri Allah nə bağışlayar, nə də onlara (başqa) bir yol göstərər. İçərisində əbədi qalacaqları Cəhənnəm yolundan başqa. Bu isə Allah üçün asandır. Ey insanlar! Peyğəmbər sizə Rəbbinizdən (gələn) haqqı çatdırdı. (Ona) iman gətirin! (Bu) sizin üçün xeyirli olar. Əgər (onu) inkar etsəniz, şübhəsiz ki, göylərdə və yerdə nə varsa, Allaha məxsusdur. Allah Biləndir, Müdrikdir." [4:168-170] Ümumilikdə imamların, xüsusilikdə isə Əlinin imamlığı şiələrdə elə bir təməl etiqad halına keçmişdi ki, onların xəyalında əlbəttə ki, ayə bu şəkildə nazil olmalı idi. Əgər biz bu ayəni bu cür Quranda onların görmək istədikləri kimi oxuya bilmiriksə bunun tək bir izahı ayənin təhrif edilmiş olması idi.

---

[261] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 7/89;

[262] əl-Kuleyni, "əl-Kəfi", 1/414;

[263] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 7/56;

[264] əl-Kuleyni, "əl-Kəfi", 1/424;

əl-Məclisi "Biharul-Ənvar" kitabında əl-Qummi'nin təfsirindən nəql edir ki, "İmam - aleyhissələm - buyurdu: "(Quranda) «və İbrahim ailəsi, İmran ailəsi və Muhəmməd ailəsi aləmlərin (üzərində) üstün tutulmuşdur» şəklində nazil olmuşdur, lakin Muhəmmədin ailəsini (Qurandan) çıxardılar." Daha sonra ət-Tusi'nin "əl-Əməli" kitabından isnadı ilə rəvayət edir ki, İbrahim bin Abdissaməd deyib: "Cəfər bin Muhəmmədi - aleyhissələm - belə oxuyarkən eşitdim: "Həqiqətən, Allah Adəmi, Nuhu, İbrahim ailəsini, İmran ailəsini və Muhəmməd ailəsini aləmlər üzərində üstün tutdu». Dedi: "Bu şəkildə nazil olmuşdur."[265] əl-Kuleyni'nin "əl-Kafi" kitabındakı rəvayətində Cabir əl-Cufi deyir ki, "Əbu Cəfərə - aleyhissələm - soruşdum: "Niyə Əliyə "möminlərin əmiri" adı verilib?" Dedi: "Onu Allah (bu adla) adlandırıb və Kitabında da bu şəkildə nazil edib: "Bir zaman Rəbbin Adəm oğullarının bellərindən onların törəmələrini çıxarmış və 'Mən sizin Rəbbiniz deyiləmmi? Muhəmməd Mənim elçim və Əli möminlərin əmiri deyilmi?" (– deyə) onları özlərinin əleyhinə şahid tutmuşdu."[266] Mövla Muhəmməd Saleh əl-Məzəndərani şərhində buyurur: "Bu ona işarədir ki, bu sözlər (Quranda bu şəkildə) nazil edilmişdi, təhrif edən münafiqlər həsəd və inad üzündən onu (Qurandan) silib çıxarıblar."[267] Yenə əl-Kuleyni rəvayət edir ki, bir nəfər İmam Cəfər əs-Sadiq'in yanında oxudu: "De: "İşinizdə olun! Allah, Onun Elçisi və möminlər əməllərinizi görəcəklər." [9:105] Bunu eşidən İmam dedi: "Bu şəkildə deyil, ayə belədir: "... və məmunlar (əməllərinizi görəcəklər)" və o məmunlar bizik."[268] Məmunlar sözü yəni Allahın etibar etdiyi, əmanətdar bildiyi şəxslərdir, beləliklə də iddiaya görə İmam Cəfər ümumilik ifadə edən "möminlər" sözünün ayədə doğru olmadığını, əslində orda "məmunlar" sözünün olduğunu deyir. Bu da ayəni imamlara aid etmək məqsədi ilə Quranın təhrifini iddia etməyin bir başqa misalıdır. Yenə əl-Kuleyni rəvayət edir ki, guya İmam əl-Baqir deyib: "Cibril - aleyhissələm - bu ayəni Muhəmmədə - salləllahu aleyhi va əlihi - bu şəkildə nazil edib: "Allahın... Əli haqqında nazil etdiyini həsəddən inkar etməklə nəfslərini satıb əvəzində aldıqları şey necə də pisdir!" Növbəti rəvayət isə belədir: "Cibril - aleyhissələm - bu ayəni Muhəmmədə bu şəkildə nazil etmişdi: "Əgər qulumuza Əli haqqında nazil etdiyimizə şübhə edirsinizsə onda ona bənzər bir surə gətirin!"

---

[265] əl-Məclisi, "Bihərul-Ənvar", 23/222;

[266] əl-Kuleyni, "əl-Kafi", 1/412;

[267] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 7/50;

[268] əl-Kuleyni, "əl-Kəfi", 1/424;

Yaxud da Taha surəsindəki - “Biz bundan əvvəl Adəmlə də əhd bağlamışdıq. Lakin o, əhdi unutdu və Biz onda əzm görmədik” [20:115] - ayəsinin əslində bu şəkildə nazil olmadığını deyirlər; İmam Cəfərə nisbət edilən bir rəvayətdə guya o deyib: “Biz bundan əvvəl Adəmə Muhamməd, Əli, Fatimə, əl-Həsən, əl-Hüseyn və onların zürriyyətindən olan imamların - aleyhissələm - haqqındakı kəlimələrdə əhd almışdıq, lakin unutdu.” Allaha and olsun ki, bu ayə Muhəmmədə bu şəkildə nazil olmuşdu.” [269] Quran ayələrinin ortasına “Əli haqqında” sözünü əlavə edərək Cibrilin o şəkildə nazil etdiyini iddia edən rəvayətlərin misalları bizim burada təqdim etdiklərimizdən xeyli çoxdur.

Eyni şəkildə Quranda “imam” sözünün imamiyyə məzhəbinə uyğun olmayan, əksinə əleyhinə olan ayələr haqqında da təhrif iddiaları varid olub. Əbul-Fəth əl-Kəracəki və başqalarının rəvayət etdiyinə görə Əbu Bəsir bir dəfə İmam əs-Sadiq üçün Quran oxuyarkən ayəni belə oxuyur: “Bizi müttəqilərə imam et!” İmam Cəfər buyurdu: “Rəbbindən çox ağır bir şey istədin! Ayə əslində belədir: “Bizim üçün müttəqilərdən bir imam ver!” Bununla bizləri qəsd edib.”[270] Şeyxut-Taifə ət-Tusi bunu əhlul-beytin qiraəti olaraq təqdim edir.[271] Həmçinin səhabələri və onların misalında ümməti tərifləyən ayələri də bu şəkildə təhrifdə ittiham edərək şiə etiqadına uyğunlaşdırmağa çalışıblar. İbn Sinan rəvayət edir ki, İmam əs-Sadiqin hüzurunda bu ayə oxundu: "Siz insanlar üçün çıxarılmış ən xeyirli ümmətsiniz." O buyurdu: "Möminlərin əmirini, Həsəni və Hüseyni - aleyhimussələm - öldürənlərmi ən xeyirli ümmətdir?! Qari dedi: “Qurban olum sənə, ayə necə nazil olub?” Buyurdu: “Ayə bu şəkildə nazil olub: "Siz insanlar üçün çıxarılmış ən xeyirli imamlarsız." Məgər görmürsənmi ki, Allah onların haqqında belə tərif edir: "Yaxşılığı əmr edir, pislikdən çəkindirir və Allaha inanırsınız."[272] Burada ayədə keçən “ümmət” sözü “əimmət” sözü ilə əvəz edilir.

Şiəlik öz zamanında elə bir mərhələdən keçib ki, orada hakim olan təsəvvür sıradan şiələr arasında dövr edən şifahi nəqllərə əsaslanırdı. Bu şifahi xəbərlərin tərkibi tamamilə xəyal məhsulu olan hekayələrlə zəngin olub. Əməvilər və abbasilərin əhlul-beytə qarşı zülmü də bu şiələrin köksündəki nifrətin şöləsini daha da şiddətləndirir və

---

[269] Eyni mənbə, 1/416-417;

[270] əl-Məclisi, “Bihərul-Ənvar”, 24/135; “Təfsir əl-Qummi”, 1/22 və 2/117;

[271] ət-Tusi, “Təfsirut-Tibyən”, 7/512;

[272] “Təfsir əl-Qummi”, 1/110; əl-Məclisi, “Bihərul-Ənvar”, 24/154;

fantaziyalarının çalarlarını çoxaldırdı. Bunun neqativ nəticələrindən biri olaraq Quran haqqında uydurulmuş şifahi bir tarix ortaya çıxdı və tədricən bu şifahi tarix şiə alimlər tərəfindən heç bir tənqidə məruz qalmadan kitablara daxil edildi. Bunun ən bariz misallarından birini "əl-İhticac" kitabının müəllifi ət-Tabrasi verir və o, Quranın təhrifini bir qədər dramatik şəkildə belə hekayət edir: "Əbu Zərr əl-Ğifari rəvayət edir ki, Peyğəmbər - sallallahu aleyhi və alih - vəfat etdikdə Əli – aleyhissəlam – Quranı bir yerə topladı və onu mühacir və ənsarın yanına gətirib onlara təqdim etdi. Çünki Peyğəmbər – sallallahu aleyhi və alih – ona bu işi vəsiyyət etmişdi. Əbu Bəkr onu açdıqda ilk səhifədə qövmün (yəni səhabələrin) rüsvayçılıqları ilə qarşılaşdı. Bunun üzərinə Ömər yerindən sıçrayıb dedi: "Ey Əli! Onu geri götür, bizim ona ehtiyacımız yoxdur." Əli – aleyhissəlam – onu götürüb geri döndü. Sonra (onlar) Quran qarisi olan Zeyd ibn Sabiti çağırdılar. Ömər ona dedi: "Həqiqətən, Əli bir Quran gətirdi və onun içində mühacir və ənsarın biabırçı işləri qeyd olunmuşdur. Biz belə qərara gəldik ki, bir Quran tərtib edək və onun içindən mühacir və ənsarın rüsvayçı hallarını və ifşalarını çıxaraq. Zeyd bu işdə onlara razılıq verdi."[273] Şiələrin əxbari qolunun ən böyük təmsilçiləri bu əfsanələrə sözün həqiqi mənasında inanıblar. əl-Kuleyni'nin "əl-Kafi" kitabında bu mənada çox sayda rəvayətlərə yer verməsi onu göstərir ki, o, həqiqətən də buna inanırdı. Ona görə də Yusuf əl-Bəhrani şiələrin bu məsələdəki ixtilafını zikr edərkən deyir ki, bu rəy əl-Qummi'nin "tələbəsi əl-Kuleyni'nin "əl-Kafi" kitabında zahirən görünən rəyidir, beləki (Quranda) silinmələrə və düşürülmələrə dəlalət edən çox sayda rəvayəti nəql edib və onları nə rədd edib, nə də təvil edib."[274] əl-Kəşəni də yazır: "Bu mövzuda şeyxlərimizin – Allah onlara rəhmət etsin – əqidəsinə gəlincə, Siqatul-İslam Muhəmməd ibn Yaqub əl-Kuleyni'nin bu barədə təhrif və Quranın naqis olması inancında olduğu aşkar görünür. Çünki o, bu məzmunda 'əl-Kafi' kitabında rəvayətlər nəql etmiş və onlara tənqidi münasibət bildirməmişdir. Halbuki kitabın əvvəlində qeyd etmişdi ki, orada nəql etdiyi rəvayətlərə etibar edir. Eyni şəkildə onun ustadı Əli ibn İbrahim əl-Qummi də bu inanca sahib idi. Çünki onun təfsiri bu cür rəvayətlərlə doludur, hətta o bu məsələdə aşırıya gedir."[275] Bunun bənzərini Əbul-Həsən əl-Amili "əl-Burhan" təfsirinin müqəddiməsində

---

[273] ət-Tabrasi, "əl-İhticac", 1/225-228;

[274] əl-Bəhrani, "əd-Durar ən-Nəcəfiyyə", 4/65;

[275] əl-Kəşəni, "ət-Təfsir əs-Safi", 1/52;

deyir.[276] əl-Kuleyni şiələrdə sözün tam mənasında əxbariliyi təmsil etməsə də rəvayət təmayüllü yanaşma onda daha ağır basırdı və "əl-Kafi" kitabı bunun bariz misallarındandır. Onun kimi eyni təfəkkürü bölüşən bir başqa rəvayət alimi Əhməd bin Əli ət-Tabrasi də "əl-İhticac" kitabında birdən çox yerdə Quranın təhrifi üzərində vurğu edir. Misal üçün kitabın bir yerində buyurur: "Quranda böyük günah sahibləri olan münafiqlərin adlarının üstüörtülü verilməsi Allahın işi deyil; bu, Quranı parçalayaraq onu dəyişdirən və təhrif edənlərin işidir. Onlar dini dünya malı ilə dəyişdilər. Allah Təala təhrif edənlərin hekayəsini bu ayədə bəyan etmişdir: 'Vay o şəxslərin halına ki, onlar öz əlləri ilə kitab yazır, sonra da "Bu, Allahın vəhyidir!" - deyirlər ki, onunla cüzi miqdarda pul əldə edə bilsinlər.'"[277] Diqqət etsək görərik ki, çıxış nöqtəsi hamısında eynidir, Quran onların xəyallarında gözlədikləri kitab deyildir. Biz kitabımızın bu hissəsində mövzunu bu baxımdan çox uzatmaq istəmirik, lakin əxbarilər ilə üsulilər arasındakı fərqlər barəsində danışarkən bu barədə şiə alimlərinin rəylərinə yer vermişik. Burada bizim üzərində durmaq istədiyimiz nöqtə bu etiqadın nə üçün əmələ gəlməsi səbəblərinə baxmaqdır.

Beləliklə də rəvayətlərdən də açıq şəkildə göründüyü kimi belə bir etiqadın əmələ gəlməsinin əsas səbəbi imamət etiqadı ilə əlimizdəki Quran arasındakı uyğunsuzluq olub. Ona görə də Musa əl-Musəvi yazır: "Ədalətli araşdırıcı üçün heç bir şəkildə şübhə yoxdur ki, mühəddisləri (rəvayətçiləri) Quranın təhrif edildiyini iddia etməyə sövq edən əsas səbəb, onların iddiasına görə, təhrif olunmuş surə və ayələrdə Əlinin imamətinə açıq şəkildə dəlalət edən ayələrin mövcud olmasıdır. Buna görə də, şiə alimlərindən bəziləri, imamət haqqında Quranda ilahi bir mətnin olmamasını, həmin iddia edilən təhrif olunmuş ayələrə istinad etməklə müdafiə edirdilər."[278] Hətta günümüzdə imamiyyə məzhəbini yaxından araşdıran qərbli müstəşriqlərdən Etan Kolhberg deyir: "Əlinin xeyrinə olan ayələrin məqsədli şəkildə Qurandan çıxarılması iddiası imami şiələrin Quranda Əli və onun haqları barəsində aşkar heç bir şeyin keçmədiyini izah etməyə imkan verir."[279]

---

[276] əl-Amili, "Mİratul-Ənvar va Mişkətul-Əsrar", səh: 83;

[277] ət-Tabrasi, "əl-İhticac", 1/370;

[278] əl-Musəvi, "əş-Şiətu vat-Təshih", səh: 131;

[279] Etan Kohlberg, "In Praise of the Few", səh: 176; Brill, Boston, 2020

## İmamət və namaz

Şiə alimləri imamət məsələsində danışdıqda onu bir çox məzmunda namazla müqayisə edirlər. Görünür ki, şiələrin müxalifləri nə üçün imamət kimi əhəmiyyətli bir məsələnin Quranda konkret dəlilləri yoxdur soruşaraq etiraz etdiklərində buna cavab olaraq namaz və zəkat kimi ibadətləri misal göstəriblər. Bu misalın məğzi isə qısaca olaraq belədir ki, namaz və zəkat kimi ibadətlərin əsli, yəni kökü Quranda gəlsə də təfsilatı Quranda deyil, sünnətdə gəlib. Sanki imamətin kökü Quranda olduğu halda təfərrüatı və təfsilatı hədislərdədir.

əl-Kuleyni bununla bağlı bir rəvayətə yer verir. Bu rəvayətdə Əbu Basir deyir: "Mən ona (yəni İmam əs-Sadiqə) dedim: İnsanlar deyirlər ki, nə üçün Allah-Təala Öz Kitabında açıq şəkildə Əlini və Əhli-Beytini – aleyhimussəlam – adları ilə zikr etməmişdir? O dedi: Onlara belə deyin: Həqiqətən, Rəsulullaha – sallallahu aleyhi və alih – namaz ayəsi nazil oldu, amma Allah onun nə üç, nə də dörd rükət olduğunu açıqlamadı. Ta ki, Rəsulullah – sallallahu aleyhi və alih – onu onlara izah etdi. Zəkat ayəsi nazil oldu, amma Allah onlara hər qırx dirhəmdən bir dirhəm verilməli olduğunu söyləmədi. Ta ki, Rəsulullah – sallallahu aleyhi və alih – bunu onlara açıqladı. Həcc ayəsi nazil oldu, amma Allah onlara "Kəbəni yeddi dəfə tavaf edin" demədi. Ta ki, Rəsulullah – sallallahu aleyhi və alih – onu onlara izah etdi."[280] Buradakı arqument qısaca belədir ki, Allah namazın əslini Quranda nass ilə bildirib, onun təfərrüatını Peyğəmbər öz sünnəsində izah edib; eyni şəkildə imamətin əslini də Allah Quranda isbat edib və təfərrüatını sünnətdə Peyğəmbər izah edib. əl-Mufid də bu rəvayətdən çıxardığı arqumentə əsaslanaraq deyir: "Necə ki, zəkat vacib olan malın miqdarına nass ilə hökm verildiyi kimi, namazın xüsusiyyətləri və qılınma qaydası, orucun xüsusiyyətləri və həcc mərasimləri də nass sabit olmuşdur – baxmayaraq ki, bütün bunlar Quranda açıq şəkildə qeyd olunmamışdır. Peyğəmbərin - sallallahu aleyhi və alih - möcüzələri də sabit olmuş və onlar insanlar üzərində hüccətə çevrilmişdir – hərçənd bunlar da Quranda aşkar şəkildə bəyan edilməmişdir. Eynilə bu cür, möminlərin

---

280 əl-Kuleyni, "əl-Kafi", 1Ə286-287; əl-Məclisi "Mirətul-Uqul" kitabında (3/213) səhih olduğunu yazır.

əmirinin - aleyhissələm - imaməti də Rəsulullah - sallallahu aleyhi və alih - tərəfindən nass ilə sabit edilmişdir, hərçənd bu məsələ Quranın açıq (sarih) mətnində yer almamışdır."[281] Bu sətrləri oxuduqdan sonra özümüzə belə bir sual verməyimiz lazımdır. Doğurdandamı namaz, zəkat, oruc və həcc kimi ibadətlər Allahın kitabında qeyri-aşkar şəkildə öyrədilir? Yoxsa burada doğru olan bu iddianın tam əksidir? əl-Mufid'in sözündən belə çıxır ki, sanki imamət Quranda sarih, yəni aşkar olmayan dəlillərlə sabit olduğu kimi namaz, oruc, zəkat da eyni şəkildə sabit olub.

Digər tərəfdən isə biz şiə alimlərinin bunun tərsini dediyini görürük. Əbu İshaq ən-Növbəxti'yə nisbət edilən "əl-Yaqut" kitabında belə yazılır: "İmamət namaz və digər ibadətlər kimi əzəmətli bir rükündur, ona görə də namaz yalnız nass ilə sabit olduğu kimi imamət də belə olmalıdır."[282] Bu sözlərdən başa düşülür ki, namaz konkret dəlillərlə sabit olduğu kimi imamət də konkret dəlillərlə sabit olmalıdır. Burdakı arqument tərsinə işləyir, çünki bu sözlərlə şiə aliminin isbat etmək istədiyi məqam budur ki, imamətin dəlilləri açıq-aşkar nass olmalıdır və bunu namazla müqayisə edir. Həqiqətən də imamət əsli şiələrin iddia etdikləri kimi dinin üsulundan ağır və əzəmətli bir əsldirsə ən azından namaz kimi Quranda və sünnətdə haqqında açıq-aşkar dəlillər olmalıdır. Bununla razılaşmamağımız mümkün deyildir. Bu sözləri şərh etmiş digər şiə alimləri bu müqayisəni daha da açıq şəkildə göstərirlər. Alləmə əl-Hilli onun sözlərin şərhində deyir: "İmamət dinin böyük və əsas rükünlərindən biridir, buna görə də onun nass ilə sabit olması vacibdir. Çünki imamətdən aşağı səviyyədə olan namaz və zəkat kimi əməllər belə nass ilə sabit olubsa, o zaman imamətin nass ilə sabit olması daha öncəlidir."[283] Alləmə əl-Hilli'nin bacısı oğlu Seyyid Amiduddin əl-Hüseyni əl-Ubeydili (681-754) öz dayısının sözlərini şərh edərkən yazır: "Çünki əhəmiyyət baxımından daha üstün olan şeyin izahına və ona dair açıq dəlil (nass) gətirilməsinə xüsusi diqqət göstərmək, ondan aşağıda olan məsələlərin izahına diqqət göstərməkdən daha önəmlidir. Həzrət Peyğəmbər - sallallahu aleyhi və alih - isə gətirdiyi şəriəti insanlara bəyan etmək üçün göndərilmişdir, beləliklə də onun şəriətin furuatını nass ilə bəyan etdiyi halda üsulunda və ərkanında ehmalkarlıq etməsi, heç bir nass etmədən bunu

[281] əl-Mufid, "əl-Məsəil əl-Ukbəriyyə", səh: 46;

[282] ən-Növbəxti, "əl-Yəqut fi İlm əl-Kələm", səh: 77; Məktəbətul-Məraşi, Qum, 1428;

[283] əl-Hilli, "Ənvarul-Mələkut fi Şərh əl-Yəqut", səh: 208;

ümmətinə buraxması imkansızdır."[284] Bütün bunlar həqiqətən də gözəl səslənir. əl-Mufid'in dediyindən fərqli olaraq biz arqumentin şəkildə qoyulması ilə razıyıq. Həqiqətən də imamiyyə məzhəbinə görə "imamət" rükunu namazdan dəfələrlə əhəmiyyətli və ağır bir əsasdır. O zaman dəlilləri nəinki namazın dəlilləri kimi, hətta ondan daha qəti və güclü olmalıdır. Lakin Quranda namaz üçün varid olmuş dəlilləri imamət üçün göstərilən dəlillərlə eyni tərəziyə qoyduğumuzda necə bir nəticə görürük?!

Hər şeydən əvvəl qeyd etməliyik ki, namaz kimi ibadətlərin əsli Quranda aşkar və sarih dəlillərlə sabit olmaqla yanaşı bu ibadətlərin bir-çox təfərrüatı belə Quranda dəlillərlə sabit olub. Namazın əslinin necə aydın şəkildə öz təsdiqini tapdığını isbat etmək üçün çox əziyyət çəkməyə ehtiyac yoxdur. Quran "namazı iqamə edin və zəkatı ödəyin" deyə xitab edən ayələrlə doludur. Təfsilata gəldikdə isə Quranda namaz, oruc, həcc kimi ibadətlərin təfsilatının olmadığını qeyd etmək batil bir iddiadır, çünki həqiqət budur ki, Quranda bu kimi əməli əhkamın bir çox təfsilatına yer verilib. Misal üçün namazın qiyamdan, rüku və səcdədən ibarət olduğu qeyd olunub. Səfərdə ikən namazın qısaldılacağı zikr olunub. Həmçinin qorxu halında namazı camaat şəklində necə qılmağın gərəkdiyi uzun bir şəkildə izah edilib. "**Sən (döyüş əsnasında əsgərlərin) arasında olub onlara namaz qıldırdığın zaman onlardan bir dəstə səninlə birlikdə namaza dursun, silahlarını da (özləri ilə) götürsünlər. Onlar (namaz qılıb) səcdə edən kimi sizin arxanıza keçsinlər. Sonra namaz qılmamış olan digər dəstə gəlib səninlə birlikdə namaz qılsın. Onlar da ehtiyat tədbirləri alsınlar və silahlarını götürsünlər. Kafirlər istəyərlər ki, kaş siz silah-sursatınızdan və əşyalarınızdan xəbərsiz (uzaqda) olaydınız və sizin üzərinizə birdəfəlik basqın edəydilər. Əgər yağışdan əziyyət çəkərsinizsə, yaxud xəstə olarsınızsa, silahlarınızı yerə qoymağınız sizə günah deyil. Yenə də ehtiyat tədbirinizi görün! Şübhəsiz ki, Allah kafirlər üçün alçaldıcı bir əzab hazırlamışdır.**" [4:102] Həmçinin namazda qiraətin necəliyini də bəyan edərək buyurur: " **Namaz qılarkən nə ucadan, nə də ürəyində oxu! O ikisinin arasında bir yol tut!**" [17:110] Həmçinin namazın bəzi şərtlərini də Quranda bəyan edib və bu şərtlərin başında

---

[284] əl-Ubeydili, "İşrəqul-Ləhut fi Nəqd Şərh əl-Yəqut", səh: 485

təharəti bəyan edib, həmçinin su tapılmadıqda torpaqla təyəmmüm etməyi öyrədib. Üstəlik həm dəstəmazı necə almağı, həm də təyəmmümü necə etməyi öyrədib. Namaz qılarkən qibləyə tərəf üz tutmağı da əmr edib. Hansı hallarda namaz qılmağın icazəli olmadığını, bunun üçün təmizlənməyin gərəkdiyini da qeyd edib. Həmçinin namaz qılarkən qibləyə üz tutmağı da bizə Quran vasitəsilə öyrədib. Məscidləri zikr edib, xüsusilə fəsad niyyəti ilə tikilmiş “Dirar məscidlərində” namaz qılmağı qadağan edib. Namazın vaxtları ilə bağlı bəzi təfsilatları da qeyd etməyi ehmal etməyib və buyurub: “"**Gündüzün iki başında və gecənin ilk vaxtlarında namaz qıl! Həqiqətən, yaxşı əməllər pis əməlləri yox edər.** ” [11:114] Həmçinin asr namazını, işa və fəcr namazlarını əmr edir və deyir: “**Gün batmağa meyl edəndən gecənin qaranlığınadək (bəlli )(vaxtlarda) namaz qıl və sübh çağı Quran oxu (fəcr namazını da qıl)! Çünki sübh çağı oxunan Quranın şahidləri olur.**” [17:78] Bir başqa ayədə bu namazların bəzilərini belə müəyyən edir: “**Ey iman gətirənlər! Sahib olduğunuz kölələr və həddi-buluğa çatmayanlar (yanınıza girmək istədikdə) qoy üç vaxtda sizdən izin istəsinlər: sübh namazından əvvəl, günorta paltarınızı çıxartdığınız zaman və gecə namazından sonra.**” [24:58] Həmçinin gecə namazları və bu namazların miqdarı haqqında, o namazlarda nə qədər Quran oxumaq barəsində əl-Muzzəmmil surəsində məlumat verilir. Cümə günü bir namazı xüsusiləşdirdiyini, o namaza getməyin vacib olduğunu və o namaz əsnasında ticarət etməyin qadağan olduğunu bizə xəbər vermişdir: “Ey iman gətirənlər! Cümə günü namaza çağırılanda Allahı yad etməyə tələsin və ticarəti dayandırın. Bilsəniz, bu sizin üçün nə qədər xeyirlidir!” [62:9] Bütün bunlar heç bir şübhəyə yer buraxmadan isbat edir ki, namazın həm əsli, həm də təfərrüatının ciddi bir hissəsi Quranda öz isbatını tapıb. Zəkat da bunun kimidir. “Yığım günü də haqqını (zəkatını, sədəqəsini) verin!" [6:141] deyərək əkin məhsullarının zəkatının yığım günü veriləcəyini bəyan edir. Toplanan zəkatın kimlərə paylanılması gərəkdiyini də izah edərək buyurur: “Zəkatlar Allah tərəfindən bir fərz olaraq yalnız yoxsullara, kasıblara, onu yığıb paylayanlara, qəlbləri (İslam dininə) isinişdiriləcək kimsələrə, kölələrin azad olunmasına, borclulara, Allah yolunda cihad edənlərə və müsafirlərə məx-susdur. Allah Biləndir, Müdrikdir.” [9:60] Bir başqa ayədə buyurur: “Müəyyən sayda olan günləri (oruc tutmalısınız.) Sizlərdən xəstə və ya səfərdə olanlar başqa günlərdə eyni sayda (oruc tutmalıdırlar. )Buna taqəti olmayanlar isə (buraxdığı hər gününün

əvəzinə) bir kasıbı yedirtməklə fidyə verməlidirlər. Kim könüllü olaraq yaxşılıq etsə, bu onun üçün daha xeyirli olar. Biləsiniz ki, sizə oruc tutmaq daha xeyirlidir. İnsanlara doğru yolu göstərən, bu yolun və (haqqı batildən) ayırd edənin açıq-aydın dəlilləri olan Quran ramazan ayında nazil edilmişdir. Sizlərdən bu aya çatan şəxslər (həmin ayı) oruc tutmalıdırlar. Xəstə və ya səfərdə olanlar isə başqa günlərdə eyni sayda (oruc tutmalıdır.) Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir. O, (istəyir ki,) siz müddəti (buraxdığınız günlərin orucunu) tamamlayasınız və sizi doğru yola yönəltdiyinə görə Onu uca tutasınız. Bəlkə şükür edəsiniz." [2:184-185] Bu ayədə Allah orucun məhdud günlərdə vacib olduğunu, səfər və xəstəlikdə üzr olduğunu, oruca güc çatdıra bilməyənlərin fidyə verəcəklərini izah etmişdir. Orucun məhz Ramazan ayında fərz olduğunu, bütün ramazan ayını oruc tutmalı olduğunu bəyan etmişdir. Bütün bunlar ibadətlərin detallarıdır. Bu o deməkdir ki, bu ibadətlərin əsli Quranda sabit olduğu kimi bir çox önəmli əhkamı da Quran qeyd edib.

Quranı oxuduğumuzda namazın, zəkatın, orucun və həccin vacib olduğunu başa düşmək çətin deyildir. Quranda "namazı iqamə edin" əmrini açıq şəkildə möminlərə çatdıran onlarla ayələr vardır, müsəlmanından tutmuş qeyri-müsəlmanına qədər heç kim bu ayələri başa düşməkdə çətinlik çəkmirlər. Əgər bir kimsə Quranı əldə edərsə, onu oxuyaraq içindəkilərlə əməl etməyə çalışarsa, namazı kitabdakı məlumatlara əsasən qılarsa, qıldığı namaz sünnətə görə doğru olmasa da onun imanı səhih olacaq, bunda heç bir şübhə yoxdur. Halbuki imamla bağlı iddialar bu baxımdan namaz kimi deyildir, çünki imamla bağlı iddia budur ki, "kim öz zamanının imamını tanımadan ölərsə cahiliyyə ölümü kimi ölər." Arada küfr ilə iman arasındakı fərq kimi bir fərq mövcuddur, atəş ilə cənnət arasındakı uçurum qədər fərq vardır.

İmamət ilə namaz arasında daha bir önəmli fərq vardır ki, imaməti namaz ilə müqayisə etməyin doğru olmadığını göstərir. Beləki namazın təfsilatı o qədər çoxdur ki, onların hamısının Quranda zikr edilməsi münasib olmaz. Namazın şərtləri, rükunları, vacibatları, müstəhəbləri, məkruhatları, namazı batil edən şeylər, namazda deyilən zikrlər, səcdənin və rükunun edilmə şəkli, səhv səcdələri və digər təfsilatlar o qədər genişdir ki, bunların hamısının Quranda zikr olunmaması anlaşılan bir məsələdir. Üstəlik namazın təfsilatları əməl ilə bağlı olduğu üçün peyğəmbərin – aleyhissələm – bunu əməldə göstərməsi çox məntiqlidir. Bu baxımdan imamətin təfsilatını namazın təfsilatı ilə eyniləşdirərək qiyas etmək doğru deyil. Çünki bu qiyas çaşdırıcı və

aldatma xarakterlidir. İmamətin təfsilatı namazın təfsilatı kimi geniş deyil. Əksinə, olduqca qısadır: bu da yalnız Peyğəmbərdən – sallallahu aleyhi və səlləm – sonra gələcək imamın adının Quranda açıq şəkildə qeyd olunmasından ibarətdir. Bu isə bir və ya iki söz, yaxud da ən çoxu bir ayə ilə ifadə edilə bilər. Belə olan halda, əgər namazın təfsilatı geniş olduğu üçün Quranda yer almayıbsa (şiələrin iddiasına görə), onda necə izah etmək olar ki, Quran imamət kimi olduqca mühüm və eyni zamanda təfsilatı qısa olan bir məsələni ümumiyyətlə qeyd etməsin? Halbuki bunun üçün bir cümlə kifayət edərdi. Beləliklə, şiələrin imamətin təfsilatını namazın təfsilatı ilə müqayisə edərək gətirdikləri qiyasın batil və əsassız olduğu açıq şəkildə aydın olur. Hətta imamətin namazla bərabərləşdirilməsi fikri ilə razı olsaq belə ortaya belə bir sual çıxacaq; o zaman nə üçün Quranda imamət ən azından namazın zikr olunduğu qədər zikr olunmayıb?! Necə olur ki, imamət namazdan qat-qat daha əfzəl və daha əhəmiyyətli bir məsələ olduğu halda Quranda heç namazın zikr olunduğu qədərinin kiçik bir hissəsi qədər belə zikr olunmayıb?! Nə zikr olunma tezliyi baxımından, nə də dəlalətinin aşkarlığı baxımından imamət namaz məsələsinə heç yaxın düşmür.

Üstəlik əl-Qadi Abdulcəbbər imamət məsələsində şiələrə rəddiyə verərkən qeyd edir ki, namazla imaməti bərabərləşdirmək şiələrə yox, cumhura dəlil olaraq xidmət edir. Çünki namazda tələb olunan sadəcə olaraq vəsflər və şərtlərdir ki, onlara isabət etdikdə mükəlləfiyyəti ödəmiş olursan. Gündə beş vaxt fərz buyurulmuş namazdan sübh namazını misal üçün götürək. Sübh namazı bir əməl olduğu üçün orada mənim müəyyən edilmiş vaxtda, müəyyən edilmiş niyyət, forma və rükət sayı ilə qılacağım namaz sübh namazının yerini doldurmuş olacaq. Yəni vəsflərə əməl etmək kifayət edir. Eyni şey cumhurun imamət haqqındakı etiqadına müvafiqdir, çünki imam məqamının cumhura görə vəsfləri və şərtləri vardır ki, bunlara müvafiq olan istənilən kəsi seçdiyimizdə imamlıq vacibiyyətini yerinə yetirmiş oluruq. Yəni bu o deməkdir ki, imamət əgər namaz ilə eyniləşdirilərsə namazda mətnlərdə keçmiş ümumi vəsflər və şərtlər bizə namazın hansı namaz olduğunu müəyyən etmək və onu doğru şəkildə yerinə yetirmək üçün kifayət edəcək. Eyni şəkildə imam məqamının şərtləri və vəsflərinə uyğun olan bir kimsəni o məqama seçmək də kifayət etməlidir. Buna cavab olaraq əl-Murtəda əş-Şərif bizə namaz ilə imamət arasındakı fərqi izah edərək yazır: “Namazda qeyd etdiyiniz şeyin caiz olmasının səbəbi odur ki, mükəlləf şəxs onun xüsusiyyətlərini və şərtlərini yerinə yetirə bilər, eləcə də öz hərəkətləri arasında düzgün olanı səhv olandan ayırd

edə bilər. Lakin imam üçün bu mümkün deyil, çünki onun bəzi xüsusiyyətləri ictihad və seçim yolu ilə əldə edilə bilməz və fərdin onları ayırd etməsi üçün bir yolu yoxdur… Bundan başqa namazda ayrı-ayrılıqda hər bir namaz müəyyən olaraq təyin olunmaz, ümumilikdə namazın vəsfi müəyyən edilir, çünki bu, mükəlləf şəxsin əməlidir, namazın onun qadir olacağı misalları vardır, namazın məqbul olanı ilə batil olanı yalnız vəsflər və şərtlərlə ayırd edilə bilər. İmama gəldikdə isə, onun şəxsini başqalarından fərqləndirəcək şəkildə müəyyən etmək mümkündür, buna görə də imam üçün hökm namazın hökmü ilə eyni olmalı deyil… Nəzərdə tutduğumuz şey, namaz və imamın bu mövzuda fərqli hökmlərə malik olduğunu izah etməkdir və namazda təsvirin fərdin özündən üstün tutulmasının səbəbi imam üçün mövcud deyil."[285] Gördüyümüz kimi bəzən imaməti namazla müqayisə edib üsul və təfsilat ayırımı baxımından bir izahat verməyə çalışırlar, digər tərəfdən isə sərf etməyən məqamda namazın imamətdən fərqli olduğunu etiraf edirlər.

Burada əslində həqiqi müqayisə imamət ilə nübuvvət arasında aparılmalıdır, çünki şiələrə görə nübuvvət üçün mövcud olan bütün əqli dəlillər imaməti də tələb edir, üstəlik imamət məqamı şiələrə görə nübuvvət məqamından üstündür, həmçinin məsumiyyət, elmdə isabət, itaətin vacibliyi baxımından imamət nübuvvətlə eynidir. Ona görə də şiələrin böyüklərindən Şeyx əs-Saduq yazır: "Peyğəmbərlər üçün caiz olan hər bir şey imamlar üçün də birə-bir vacibdir, lazımdır…" Daha sonra deyir ki, "… peyğəmbərlər ilə imamlar arasındakı bənzərlik açıqdır, aydındır… və hər kim imamların halını peyğəmbərlərin halına müqayisə edərsə, peyğəmbərlərin etdiklərini imamların etdiklərinə dəlil gətirərsə, müqayisəsində doğruya isabət etmişdir…"[286] Həmçinin tələbəsi əl-Mufid yazır: "İmamlarımızın peyğəmbərlik məqamı ilə adlandırılmasını yalnız şəriət qadağan etmişdir, yoxsa əql bunu qadağan etmir, çünki bizim sözünü etdiyimiz peyğəmbərlərin – aleyhimussələm - əldə etdikləri mənaları onlar da (yəni imamlar da) əldə ediblər…"[287] Beləliklə də əl-Mufidə görə əqlən imamlar ilə peyğəmbərlər arasında bir fərq yoxdur və imamların peyğəmbərlər adlanmamasının yeganə səbəbi şəriətin bunu qadağan etməsidir. Əgər əs-Saduq və tələbəsi əl-Mufid haqlıdırlarsa və peyğəmbərimizdən –

---

[285] "əş-Şəfi fil-İmamə", 2/58-60;

[286] əs-Saduq, "Kəməlud-Din va Təməmul-Minnə", səh: 34-36; Muəssəsətul-Aləmi, Beyrut, 1991

[287] əl-Mufid, "Əvailul-Məqalət", səh: 45;

salləllahu aleyhi va alihi va səlləm – sonra ona bərabər imamların olması nəzəriyyəsi haqdırsa o zaman Quranda bu, öz əksini tapmalıdır. Quranda Allah – cəllə cələluhu – dörd yerdə peyğəmbərimizin adını çəkir. İddia olunan imamın adı isə Quranda heç bir yerdə keçmir, heç ümumiyyətlə onun şəxsinə dair aşkar bir dəlalət yoxdur.

## Qurandan kənarda

Nəhayət onu da əlavə etməliyik ki, ümumiyyətlə bu mövzunun çərçivəsində müzakirə olunan ayələrin dəlil göstərilməsi üslubu Quranın özündən kənarda qalır. Daha aydın dildə desək, zahirdə Quran ayələri dəlil gətirilsə də dəlilin ağırlığı Qurandan kənar xəbərlərə dayanır. Misal üçün Şura surəsində Allah - təbərakə va təalə - buyurur: “Allahın iman gətirib yaxşı işlər görən qullarına verdiyi müjdə budur. De: “Bunun müqabilində sizdən qohumluq sevgisindən başqa heç bir əvəz istəmirəm”. Kim yaxşı bir iş görərsə, orada onun yaxşılığını (savabını) artırarıq. Şübhəsiz ki, Allah bağışlayandır, şükrün mükafatını verəndir.” [42:23] Bu ayədə keçən “sizdən qohumluq sevgisindən başqa heç bir əvəz istəmirəm” sözlərini göstərərək deyiblər ki, məqsəd Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - qohumlarını sevməkdir. İddia edirlər ki, ayədə Allahın elçisi müşrikləri haqqa dəvət etməyin müqabilində ücrət olaraq onlardan əhli-beytini sevməyi tələb edib. Ayəni belə bir mənada təfsir etmək onu öz zahirindən uzaqlaşdırmaq ilə mümkündür və bunu yalnız bəzi rəvayətlər göstərməklə edə bilirlər. Hətta bu miqdarı belə məqsədi isbat etmək üçün kifayət etmir, ayədəki qohumların məhz Əli, Fatimə, Həsən və Hüseyndən ibarət olduğunu isbat etməli olurlar. İbrahim əl-Musəvi əz-Zəncani deyir: “Cumhur iki “əs-Sahih” kitabında, Əhməd bin Hənbəl müsnədində və əs-Sə’ləbi təfsirində rəvayət ediblər ki, İbn Abbas deyib: “Bu ayə nazil olduqda soruşdular: “Ey Allahın elçisi, o qohumların kimdir ki, onları sevmək bizə vacib oldu?” Dedi: “Əli, Fatimə və iki oğlu.”[288] Daha sonra da əlavə edirlər ki, əgər bu şəxsləri sevmək möminlərə vacibdirsə deməli onlara itaət etmək də möminlərə vacib

[288] əz-Zəncani, “Aqaid əl-İməmiyyə əl-İsnə Aşəriyyə”, səh: 85;

olmalıdır, çünki sevməyin kamilliyi yalnız itaətlə mümkündür. Onlara itaət etmək vacibdirsə deməli onlar bu ümmətin imamlarıdırlar. əz-Zəncani bunu belə ifadə edir: "Sevməyin vacibliyi itaətin vacibliyini tələb edir, çünki sevgi yalnız məsum olduqları üçün vacib olur."[289] Demək istəyir ki, məsum olmasaydılar Allah onları sevməyi bizə vacib buyurmazdı, çünki günah edə bilən şəxsləri sevmək əqlən vacib ola bilməz. Əgər məsumdurlarsa deməli onlara itaət etmək də vacib olur. Beləliklə də şiə-sünni diskursunda "məvəddət ayəsi" olaraq tanınan bu ayəni bir-neçə əcaib addımlara imamətə dəlil göstərməyə çalışırlar.

Bu misal bizə aşkar şəkildə göstərir ki, şiə məzhəbində Qurandan imamətə dair gətirilən dəlillər bu şəkildə tapmaca üslubundadır. Çünki hər şeydən əvvəl ayədə qəsd olunan Peyğəmbərin qohumlarını sevmək deyildir, çünki ayədə ümumiyyətlə "Peyğəmbərin qohumları" sözü yoxdur. Ayədə keçən "əl-məvaddətə fil-qurba" sözü ərəb dilindən tərcümədə "qohumluğa görə sevgi" deməkdir. "Qurbə" sözü yaxınlıq, qohumluq deməkdir və Quranda bu söz bu formada heç yerdə "qohumlar" mənasında gəlməyib. Əgər bu söz qohumlar mənasını ifadə etmək üçün işlənirsə heç zaman bu şəkildə tək formada işlədilmir, əksinə mürəkkəb forma seçilir. Ya "zəvil-qurbə" və "zul-qurbə" ya da "ulul-qurbə" şəklində "qohumluq sahibləri" mənasını ifadə edərək qohumları qəsd edir, lakin tək formada "qurbə" sadəcə olaraq "qohumluq", "qohumluq bağı" mənalarını bildirir. Görəsən nə üçün Quranda digər bütün ayələrdə "qohumlar" mənası qəsd olunduqda bu şəkildə mürəkkəb sözlər olaraq işləndiyi halda burada mücərrəd olaraq gəlib?! Ona görə də Ayətullah Əbul-Fədl əl-Burqui yazır: "Kaş biləydim! Niyə hər dəfə söhbət imamlar və imamət mövzusuna gələndə, Quran – Allah uzaq eləsin – bəlağətdən və aşkar ifadədən uzaqlaşır, sözləri öz lüğəvi mənasında dəqiq şəkildə istifadə etmir? Niyə ayənin mənasını anlamaqda bizə hədislərin kömək etməsinə ehtiyac yaranır və sözlərin zahiri mənasından üz çevirməyə məcbur qalırıq?"[290] Üstəlik ayədə "qohumluğu sevmək" sözü də keçmir, "qohumluğa görə sevmək" sözü keçməkdədir. Möminlərin arasındakı sevginin Allah üçün olduğunu ifadə etmək istəsən "əl-məvəddətu filləh" deyə bilərsən. Ona görə də İbn Cərir ət-Təbəri təfsirində deyir: "**Bu ayənin təfsirində deyilmiş rəylər arasında ən doğruya yaxın və ayənin zahirinə ən çox bənzəyən rəy, bu rəy-dir ki, ayənin mənası: "De: Ey qureyşlilər!**

---

[289] Eyni mənbə

[290] əl-Burqui, "Ardu Əxbəril-Usul aləl-Quran val-Uqul", səh: 635;

**Mən sizdən (bu risalətə qarşılıq olaraq) heç bir mükafat istəmirəm, ancaq sizinlə aramızdakı qohumluğa görə mənə sevgi göstərməyinizi, mənimlə sizin aranızdakı qohumluq bağlarının haqqını verməyinizi istəyirəm".** Bu təfsirin ayənin izahında ən doğru təfsir olduğunu ona görə dedim ki, çünki ayədə (إِلَّا الْمَوَدَّةَ فِي الْقُرْبَى) ifadəsində "في" ədatı işlədilib. Əgər bəzi müfəssirlərin dediyi kimi bu "mənim qohumlarıma sevgi bəsləyin" və ya "Allaha yaxınlaşın" mənasında olsaydı, o zaman bu cür "في" ədatının bu yerdə istifadəsinin heç bir aydın izahı olmazdı. Əgər Allahın elçisinin - salləllahu aleyhi va səlləm - qohumlarını sevmək əmr olunsaydı, ayə "İllə məvaddətə'l-qurba" şəklində gələrdi, əgər məqsəd saleh əməlləri ilə Allaha yaxınlaşmaq yolu ilə sevgi qazanmaq mənasında olsaydı, o zaman "illa'l-məvaddətə bil-qurba" və ya "əl-qurba" şəklində gələrdi. Ayədə "في" ədatının işlədilməsi açıq şəkildə göstərir ki, mənası budur: "**Ancaq sizdən istəyim mənim sizinlə olan qohumluğum çərçivəsində məni sevməyinizdir.**"[291] Müfəssirlər nəzdində məqbul olan təfsir də budur. Bunun əsas səbəbi isə budur ki, bu təfsir ayənin zahirinə müvafiqdir və üstəlik İbn Abbas'dan bu barədə təfsir sabit olub. Beləki əl-Buxari "əs-Sahih" kitabında rəvayət edir ki, İbn Abbas'dan "qohumluq sevgisindən başqa" ayəsi barədə soruşuldu. Səid ibn Cubeyr dedi: "Bu, Mühəmmədin – sallallahu aleyhi və səlləm – ailəsinin qohumluğu deməkdir." İbn Abbas isə dedi: "Tələsdin! Həqiqətən, Qureyşin elə bir qolu yoxdur ki, Peyğəmbərin – sallallahu aleyhi və səlləm – onlarla qohumluğu olmasın." (İbn Abbas) dedi: "Sizdən istədiyim tək bir şey aramızdakı qohumluq bağlarını qoruyub saxlamağınızdır."[292] əz-Zəncani'nin iddiasına gəldikdə isə nə iki "əs-

[291] "Təfsir ət-Təbəri", 20/502 Turki çapı,

[292] "Sahih əl-Buxari", 4541; İbn Kəsir (7/187) deyir: "Eynilə bu mənanı İbn Abbas'dan Amir əş-Şabi, əd-Dahhāk, Əli ibn Əbi Talhə, əl-Əufi, Yusuf ibn Mihran və daha bir neçə nəfər rəvayət etmişdir. Həmçinin Mücahid, İkrimə, Qətadə, əs-Suddî, Əbu Malik və Abdurrahman ibn Zeyd ibn Əsləm və başqaları da bu görüşdə olmuşlar. əl-Hakim (əl-Müstədrək, 2/444) öz sənədi ilə — Amr ibn Aun vasitəsilə, Huşeymdən, o isə Dəvud ibn Əbi Hinddən, o da əş-Şəʿbîdən — belə rəvayət edir: "İnsanlar bu ayə haqqında — "De: "Bunun müqabilində sizdən qohumluq sevgisindən başqa heç bir əvəz istəmirəm" — bizə çox sual etdilər. Biz də bu barədə İbn Abbasa yazdıq və ondan izah istədik. İbn Abbas bizə yazdı ki: "Həqiqətən, Allah Rəsulu - sallallahu aleyhi və səlləm - Qureyşin ən göbək ailəsindəndir. Qureyşdə elə bir qol yoxdur ki, ounla qohum olmasın. Buna görə Allah — azzə va cəllə — buyurdu: 'De: Mən sizdən buna görə heç bir əvəz istəmirəm, ancaq sizdən istəyim budur ki, mənimlə aranızdakı qohumluğu qoruyub saxlayasınız." Huşeym əlavə edir: Həmin mənanı Hüseyn də mənə İkrimədən, o da İbn Abbasdan rəvayət etdi." əl-Hakim deyir: "Bu, səhih bir hədisdir və Buxari ilə Müslim bu hədisi bu ziyadə ilə rəvayət etməmişlər. Amma hədis onların

Sahih" kitabında, nə Əhmədin müsnədində, nə də digər mötəbər hədis qaynaqlarında elə bir rəvayət yoxdur. Şiə alimlərinin heç bir əsası olmayan bu cür rəvayətləri nəql edərkən onları sünnət əhlinin ən etibarlı kitablarına nisbət etmələri tez-tez rastlaşdığımız bir haldır. Çox təəssüf ki, bu cür yalanlar bir çox siravi şiəni aldadıb və aldatmağa davam edir.

Yaxud ər-Rad surəsində Allah buyurur: "Kafirlər: "Rəbbindən ona bir möcüzə endirilməli deyildimi?" - deyirlər. Sən yalnız xəbərdar edənsən. Hər qövmün doğru yolu göstərən bir rəhbəri vardır." [13:7] İbn Mutahhər əl-Hilli yazır: "(əd-Deyləmi'nin) "əl-Firdəvs" kitabında İbn Abbasdan nəql edilən rəvayətdə deyir: "**Allahın elçisi - sallallahu əleyhi və səlləm - buyurdu: «Xəbərdar edən (əl-munzir) mənəm, Əli isə hidayət verəndir (əl-hadi). Ey Əli! Sənin vasitənlə doğru yola yönələnlər hidayət taparlar.»** Bunun bənzərini Əbu Nuəym rəvayət edib. Bu hədis açıq şəkildə **Əlinin vilayət və imamətinin sabit olduğunu** ifadə edir."[293] Digər şiə müəlliflər də bu ayəni və bu barədə gəlmiş rəvayəti Əlinin imamlığı üçün dəlil gətirirlər. Ayəni oxuyan heç kimsə ayənin özündən belə bir məna başa düşmür, ona görə də rəvayətə baş vurmağa ehtiyac yaranır. Rəvayət isə həm mətn baxımından, həm də isnad baxımından uydurmadır.[294] Bu rəvayəti uyduran kəs bununla Əlinin məqamını yüksəltmək üçün Peyğəmbərin məqamını alçaltdığını düşünməyib. Bəlkə də düşünüb, ancaq Əlinin imamlığını isbat etmək məsləhəti daha ağır gəlib. Bu rəvayətə görə Əlinin məqamı daha üstündür, çünki Peyğəmbər sadəcə xəbərdar edən olduğu halda, Əli birbaşa hidayət edəndir. Bu hədisin mötəbər hədis kitablarında keçməməsinə baxmayaraq şiə alimi Şərəfuddin əl-Musəvi yazır ki, "bunu "əs-Sünən" müəllifləri İbn Abbas'dan rəvayət

---

şərtlərinə görə səhihdir. Çünki İkrimənin hədisi Buxarinin, Dəvud ibn Əbi Hindin hədisi isə Müslimin şərtlərinə uyğundur. Hafiz İbn Həcər "Fəth al-Bari" kitabında (8/565) bu hədisi Səid ibn Mənsura isnad etmişdir.

[293] əl-Hilli, "Minhəcul-Kəramə", səh: 126;

[294] Bu rəvayəti İbnul-Arabi "Mucəmuş-Şuyux" kitabında (2328) əl-Fədl bin Yusuf vasitəsi ilə əl-Həsən bin əl-Hüseyn əl-Arani, o isə Muaz bin Muslim'dən rəvayət edir. Muaz bunu Ata bin əs-Səib'dən, o Said bin Cubeyr'dən, o isə İbn Abbas'dan rəvayət edir. əz-Zəhəbi "Mizənul-İtidəl" kitabında (1/484) bu xəbəri zikr etdikdən sonra yazır: "Muaz məchuldur, ola bilsin (rəvayətin) afəti ondandır." Muaz Kufənin şiə ravilərindəndir, halı məchuldur. Həsən əl-Arani isə siqalardan münkər xəbərlər rəvayət etməklə tanınmış bir başqa aşırı şiə ravilərdəndir. İbnul-Cəvzi "Zədul-Məsir" kitabında (2/484) deyir ki, "bu, rafizilərin uydurmalarındandır." İbn Kəsir təfsirində (8/110) qeyd edir ki, "bu hədisdə şiddətli münkərlik var."

ediblər."[295] Bunun yalan olduğunu isbat etmək çətin deyildir, çünki "əs-Sunən" sahiblərinin kitablarında belə bir hədis yoxdur.

"Ey iman gətirənlər, Allahdan qorxun və sadiqlərlə (doğru insanlarla) birlikdə olun!" [9:119] əz-Zəncani bu ayəni dəlil olaraq belə təqdim edir: "Ayədə "sadiqlərlə olun" buyurulması ilə məqsəd, onlarla birlikdə əbədiyyət boyu fiziki birlikdə olmaq deyil, **onların söz və əməllərində onlara tabe olmaq**dır. Çünki əbədi olaraq bir yerdə olmaq mümkün deyil və bunun faydası da yoxdur. Bu xitab **bütün zaman və məkanlarda yaşayan möminlərə** yönəlib. O halda hər dövrdə elə bir **"sadiq" şəxs** olmalıdır ki, ona tabe olmaq vacib olsun. Əgər "sadiq" sözünü hər hansı bir vaxtda doğru danışan bir kəs kimi başa düşsək, o zaman **bir dəfə doğruluq göstərən hər kəsi** izləmək vacib olar ki, bu isə **bütün müsəlmanların ittifaqı ilə batildir**. Deməli, ayədəki "sadiq" dedikdə **bütün söz və əməllərində doğru olan şəxs**, yəni **məsum biri** nəzərdə tutulur. Bu isə **hər zamanda bir məsumun varlığının və ona itaətin vacib** olduğunu göstərir. Bəlli olduğu kimi, bu xüsusiyyətlər yalnız **Əli və onun övladlarında** mövcuddur. Bu da onların imamətini isbat edir. Bundan əlavə, **sünni mənbələrində** də bu mənanı dəstəkləyən rəvayətlər var. Məsələn, **əs-Suyuti** "əd-Durr əl-Mənsur" kitabında və əs-**Sə'ləbi** öz təfsirində **İbn Abbasdan** rəvayət edirlər ki, bu ayədəki "sadiqlərdən" məqsəd **Əhli-Beytin sadiqləri**dir. Habelə **Əli (əleyhissəlam)** da bu barədə demişdir: "Sadiqlər, Rəsulullahın - sallallahu əleyhi və alih - itrətidir."[296] əl-Hilli isə bunu belə ifadə edir: "Allah sidq ilə tanınanlar ilə birlikdə olmağı bizə vacib buyurub, belə biri isə məsumdan başqası ola bilməz, çünki başqalarının yalan danışması mümkündür. Beləliklə də o, Əli - aleyhissələm - olmalıdır, çünki dörd xəlifə içində ondan başqa məsum yoxdur. Əbu Nueym'in İbn Abbas'dan hədisində deyir ki, bu ayə Əli haqqında nazil olub."[297] Hər şeydən əvvəl ayədəki "sadiq" sözünü məsum olaraq izah etməyə çalışmaq xətalıdır. Quranın dili heç buna dəlalət etmir. Allah - təbərakə va təalə - buyurur: "(İsa dedi) Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!" Allah dedi: "Bu, sadiqlərə sidqlərinin fayda verəcəyi gündür! Onlar üçün (ağacları) altından çaylar

---

[295] əl-Musəvi, "əl-Muracəat", səh: 89;

[296] əz-Zəncani, "Aqaid əl-İməmiyyə əl-İsnə Aşəriyyə", səh: 82-83;

[297] əl-Hilli, "Minhəcul-Kəramə", səh: 142;

axan və içində əbədi qalacaqları Cənnət bağları hazırlanmışdır". Allah onlardan razıdır, onlar da Ondan razıdırlar. Bu, böyük uğurdur." [5:118-119] Aydındır ki, Cənnət təkcə məsumlar üçün hazırlanmayıb, lakin günah etsə də imanında sadiq qalanlara da Cənnət vəd verilib. Çünki İsanın - aleyhissələm - özünə ibadət edənlər barəsində dediyi sözdən sonra Allahın Onun Cənnətinə məsumların daxil olacağını deməsinin heç bir mənası yoxdur. Bir başqa ayədə buyurur: "Bir zaman Biz peyğəmbərlərdən əhd almışıq; səndən də, Nuhdan da, İbrahimdən də, Musadan da, Məryəm oğlu İsadan da! Biz onlardan möhkəm bir əhd almışıq. (Belə etmişik) ki, (Allah) sadiqlərin sidqi barədə soruşsun və kafirlər üçün isə ağrılı-acılı bir əzab hazırlasın." [33:7-8] Bu ayədə də Allah insanlara iki qismə ayırır; sadiqlər və kafirlər. Şübhəsiz ki, burada sadiqlər ilə qəsd olunan imanlarında sadiq olanlardır. Dəlalətində bundan da aşkar olan ayədə Allah - cəllə cələluhu - bizə sadiqlərin kimlər olduğunu öyrədərək deyir: "(Qənimətlər həmçinin) yurdlarından qo¯¯vulmuş və malların¯¯dan məhrum olunmuş yoxsul mühacirlərə məxsusdur. Onlar Allahın mərhəmətini və razılığını qazanmağa can atır, Allaha və Onun Elçisinə kömək edirlər. Sadiqlər də məhz onlardır." [59:8] Bu ayə çox aşkar şəkildə bizə sadiqlərin kimlər olduğunu izah edir. Ayənin Əli haqqında nazil olması iddiasına gəldikdə isə bu, yalandır. əs-Sələbi təfsirində bu ayənin izahı ilə bağlı bir çox rəy qeyd edir. "Nafi dedi: Muhəmməd və onun səhabələri ilə". Said bin Cubeyr dedi: "Əbu Bəkr və Ömər ilə." İbn Cureyc və İbn Həyyan dedi: "Mühacirlər ilə." Bunun dəlili Allahın "yoxul mühacirlərə" sözündən "sadiqlər də məhz onlardır" sözünə qədər olan ayəsidir." əs-Sələbi bunu qeyd etdikdən sonra deyir: "Abdullah bin Muhəmməd bin Abdilləh mənə xəbər verdi: dedi: Muhəmməd ibn Osman bin əl-Həsən bizə xəbər verdi: Muhəmməd bin əl-Hüseyn bin Saleh bizə xəbər verdi: Əli bin Cəfər bin Musa bizə xəbər verdi: Cəndəl bin Valiq bizə xəbər verdi: Muhəmməd bin Ömər əl-Məzini bizə xəbər verdi: əl-Kəlbi bizə Əbu Saleh'dən, o da İbn Abbasdan bu ayə haqqında belə dediyini xəbər verdi və dedi: "Əli bin Əbi Talib və onun yoldaşları ilə."[298] Problem budur ki, bu rəvayət məchul, zəif, yalançı ravilərdən ibarətdir. Muhəmməd bin əs-Səib əl-Kəlbi yalanda ittiham olunmuş rafizi bir ravidir. Həmçinin Muhəmməd bin Osman bin əl-Həsən'ə gəldikdə çox ehtimal ki, Qazi Əbul-Həsən ən-Nuseybi'dir və yalançı olmaqla məşhurdur, "şiələr üçün münkər

[298] "Təfsir əs-Sələbi", 14/122;

xəbərlər rəvayət edər və onlar üçün uydurardı."[299] Yenə eyni Muhəmməd bin Osman vasitəsi ilə rəvayət edir ki, guya Muhəmməd əl-Baqir bu ayənin Muhəmmədin ailəsi barədə olduğuna dairdir. "Bu ayə **Təbuk səfərinə** qatılmayan **Kə'b ibn Malik**in hadisəsi ilə əlaqədar nazil olmuşdur. O, Peyğəmbərə – sallallahu aleyhi və səlləm – **doğru danışdı** və səfərdən geri qalmasına **heç bir üzrünün olmadığını** bildirdi. **Doğruluğunun bərəkəti ilə** Allah onun tövbəsini qəbul etdi. Halbuki bir qrup insan ona **digər münafiqlər kimi üzr uydurmasını və yalan danışmasını** tövsiyə etmişdi. Münafiqlər bəhanə gətirib yalan danışmışdılar. Bu hadisə **səhihlərdə, müsnədlərdə, təfsir və sirə kitablarında** sabitdir və alimlər bunun üzərində **ittifaq halındadırlar**."[300]

Gördüyümüz kimi bu misallarda Quran ayələrində olmayan mənalar batil və saxta rəvayətlərin köməyi ilə ayələrə israrla idxal edilir. Halbuki ayənin zahiri bütün müsəlmanların başa düşə biləcəkləri və mömin təqvası üçün əhəmiyyət kəsb edən bir mənadadır. Bir kimsə çıxıb iddia edə bilər ki, bu kimi məsələlərdə Quranı doğru başa düşmək üçün mütləq rəvayətlərə ehtiyac var, ona görə də rəvayətlər olmadan bu ayələrdə gizli olan mənaları başa düşə bilmirik. Belə bir iddia Qurana qarşı bir cinayət olar, çünki Allah Quranı bəyan və nur adlandırırsa mütləq bu cür olması labüddür. Bəli! Quranda bəzi füruatı başa düşmək üçün rəvayətlərə ehtiyac var, bu daha çox mücməl olanın təfsilatlı şəkildə izahata ehtiyac duyduğu yerlərə aiddir. Lakin haqqa və imanın təməl mövzularına irşadda Quranın başqa bir bəyana ehtiyacı ola bilməz. Bu nöqtədə şiə alimi ət-Tabətabəi'nin bu sözləri ilə razılaşmalıyıq, beləki o deyir: "Haqq budur ki, Qurani-Kərimi anlamaq yolu qapalı deyildir. İlahi bəyan və hikmətli Zikr (Qurani-Kərim) özü-özlüyündə özünə yol göstərən bir bələdçidir; yəni məqsədlərini izah etmək üçün başqa bir yola ehtiyac duymur. Necə düşünmək olar ki, Allah Təalanın *hidayət*, *nur* və *hər şeyi bəyan edən* bir kitab kimi tanıtdığı bir kitab, özündən başqa bir bələdçiyə, başqa bir nurun işığına və başqa bir izahata möhtac olsun?"[301] Ümumilikdə imamət məqamı üçün, xüsusilikdə isə Əli bin Əbi Talibin - kərraməllahu vachəhu - imamlığı üçün gətirilən dəlillərin heç biri özlüyündə qəsd edilən

---

[299] əl-Hələbi, "əl-Kəşf əl-Həsis", səh: 240;

[300] İbn Teymiyyə, "Minhəc əs-Sunnə ən-Nəbəviyyə", 7/267

[301] ət-Tabətabəi, "Təfsirul-Mizən", 3/86;

mənalara dəlalət etmirlər, yalnız rəvayətlərə baş vurmaqla ayələri qeyri-adi şəkildə o mənalara uyğun şəkildə yozurlar.

Burada düşündürücü məsələlərdən biri də budur ki, imamiyyət etiqadına görə - yuxarıda tanış olduğumuz kimi - imamət etiqadın səhihliyi üçün şərtdir. Bu o deməkdir ki, Allaha iman gətirsən, Peyğəmbərinə iman gətirsən, lakin on iki imamdan hansısa birinə iman etməsən sənin imanın keçərli deyildir, sən mömin sayılmazsan. Bu müddəanın tutarlığını yoxlamaq çətin deyildir, bunun üçün Quranın bizə həqiqi iman sahiblərini necə vəsf etdiyinə baxmağımız lazımdır. Quran bizə həqiqi iman sahibinin kimlər olduğunu açıq-aşkar ayələrlə bəyan edir və bu ayələrin nə ləfzində, nə də məzmununda imamətə inanmaq şərti yoxdur. Allah - təbarəkə va təalə - buyurur: "Möminlər o kəslərdir ki, Allaha və Peyğəmbərinə iman gətirər, sonra da bundan əsla şübhəyə düşməz və Allah yolunda malları və canları ilə cihad edərlər. Məhz onlar sadiq olanlardır." [49:15] Ayə bizə imamın həqiqətini doğrulamaq üçün iki şeyə iman etməyi meyar göstərir. Bunlardan biri Allaha iman etməkdirsə digəri Onun elçisinə iman etməkdir. Şiə alimi Şeyxut-Taifə ət-Tusi bu ayənin təfsirində deyir: "Sonra Allah həqiqi mömini təsvir edərək buyurdu: **"Möminlər o kəslərdir ki,"** – yəni, gerçək möminlər yalnız o kəslərdir ki, – **"Allaha iman gətirərlər"**, Onun varlığına və birliyinə səmimi şəkildə iman edərlər və **"Onun Peyğəmbərinə iman gətirərlər"**, yəni Allahın Elçisinin peyğəmbərliyini təsdiqləyərlər. **"Sonra da şübhəyə düşməzlər"**, yəni bu imandan sonra onların heç bir sözündə və etiqadında tərəddüd və ya şübhə olmaz. **"Allaha yolunda malları və canları ilə cihad edərlər"**, yəni Allahın dinini yaymaq və qorumaq üçün həm mal-dövlətlərini, həm də canlarını fəda edərlər. Sonra buyurdu: **"Məhz onlar sadiq olanlardır"**, yəni yalnız bu xüsusiyyətlərə sahib olanlar söylədikləri iman sözündə doğrudurlar; dilləri ilə deyib, qəlbləri ilə təsdiq etməyənlər deyil."[302]

Nisa surəsində də buyurur: "Ey iman gətirənlər! Allaha, Onun Peyğəmbərinə, Peyğəmbərinə nazil etdiyi Kitaba və daha əvvəl nazil etdiyi kitablara iman gətirin (imanınızda əzmkar olun)! Kim Allahı, mələklərini, kitablarını, peyğəmbərlərini və axirət gününü inkar edərsə, (haqdan) uzaq bir zəlalətə düşmüş olar." [4:136] Başqa ayədə buyurur: "Yaxşı əməl üzünüzü məşriqə və məğribə tərəf çevirməyiniz deyildir.

[302] ət-Tusi, "Təfsirut-Tibyən", 9/352;

Lakin yaxşı əməl (sahibləri) Allaha, Axirət gününə, mələklərə, kitablara, peyğəmbərlərə iman gətirən, sevdiyi malı qohum-əqrəbaya, yetimlərə, kasıblara, müsafirlərə, dilənənlərə və kölələrin azad edilməsinə sərf edən, namaz qılıb zəkat verən, əhd bağladıqda əhdlərini yerinə yetirən, sıxıntı və xəstəlik üz verdikdə, habelə döyüşdə səbr edən şəxslərdir. Onlar imanlarında doğru olanlardır. Müttəqi olanlar da elə məhz onlardır.” [2:177] Hər iki ayədə Allah - cəllə cələluhu - imanın şərtlərini qeyd etmişdir. Buna qədər etiqadını da əlavə edə bilərik, çünki Allah - azzə va cəllə - buyurur: “Yer üzündə baş verən və sizin başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, Yazıda (müəyyənedilmiş) olmasın. Şübhəsiz ki, bu, Allah üçün çox asandır.” [57:22] Başqa ayədə deyir: “Harada olursunuzsa olun, ölüm sizi haqlayacaq. Hətta yüksək qalalarda olsanız belə. Onlara bir yaxşılıq üz verdikdə: “Bu, Allahdandır!”– deyər, bir pislik üz verdikdə isə: “Bu, səndəndir!”– deyərlər. De: “Hamısı Allahdandır!” Bu adamlara nə olub ki, az qala söz də anlamırlar?” [4:78]

Qurana bu şəkildə yanaşdıqda başa düşürük ki, imamlara iman gətirmək heç bir şəkildə Quranın mətnində imanın meyarı kimi göstərilməyib. Ümumiyyətlə “imam” məqamı və ya buna yaxın bir məqamda xüsusi bir kateqoriya Quranda zikr edilmir. Allah insanları fəzilət baxımından dərəcələrə böldükdə heç yerdə belə bir dərəcənin olduğunu zikr etmir. Allah - cəllə cələluhu - buyurur: “Kim Allaha və Peyğəmbərə itaət edərsə, onlar Allahın nemət bəxş etdiyi peyğəmbərlər, siddiqlər, şəhidlər və salehlərlə birlikdə olacaqlar. Onlar nə gözəl yoldaşlardır!” [4:69] Burada dərəcə baxımından peyğəmbərləri, sonra siddiqləri, sonra şəhidləri və sonra salehləri yad etmişdir və başqa ayələrdə bu kateqoriyaları ayrı-ayılıqda zikr edir. Əgər “imamlar” və ya “vasilər” adlı xüsusi bir kateqoriya, üstəlik peyğəmbərlikdən də üstün bir məqam olsaydı Allah - azzə va cəllə - mübarək kitabında bunu zikr etməyi ehmal etməzdi. Əksinə belə bir məqamın digər məqamlarla yanaşı zikr olunmaması onu göstərir ki, ilahi mətnlərdə belə bir məna öz təsdiqini tapmayıb.

Allah - təbərakə va təalə - buyurur: “Allah (axirətdə): “Ey Məryəm oğlu İsa! Sənmi insanlara: “Allahı qoyub məni və anamı ilah qəbul edin!” – demisən?!” – buyurduğu zaman (İsa peyğəmbər belə) deyəcək: “Sən pak və müqəddəssən! Haqqım olmayan bir şeyi demək mənə yaraşmaz. Əgər onu demiş olsaydım, Sən onu mütləq bilərdin. Sən ürəyimdə olanı bilirsən. Mən isə Sənin zatında olanı bilmirəm. Şübhəsiz ki, gizli olanları bilən Sənsən. Onlara yalnız Sənin mənə əmr etdiyin:

"Mənim də, sizin də Rəbbiniz olan Allaha ibadət edin!" – sözünü demişdim. Aralarında olduğum müddət ərzində onlara nəzarət edirdim. Sən məni vəfat etdirincə, onlara nəzarətçi Sən Özün oldun. Sən hər şeyi görənsən." [5:116-117] Bu ayədə İsa peyğəmbər - aleyhissələm - Allahın xəbər verdiyi kimi çox önəmli bir şahidliyə yer verir, beləki "aralarında olduğum müddət ərzində onlara nəzarət edirdim" deyir və əlavə edir ki, "Sən məni vəfat etdirincə, onlara nəzarətçi Sən Özün oldun!". Əgər iddia olunduğu kimi hər bir peyğəmbərin bir vasisi olmalıdırsa, iddia olunduğu kimi heç bir zamanın hüccətdən xali olması mümkün deyilsə o zaman burada İsa peyğəmbərin cavabı məntiqsiz görünür. Əgər öz sağlığında ikən qövmü üzərində şahid özü idisə, vəfat etdikdən sonra şahid onun vasisi olmalı idi, lakin İsa peyğəmbər belə bir şey zikr etmir. Əgər desələr ki, burada sadəcə olaraq İsa öz üzərindən iftiranı təmizləmək istəmişdir, ona görə də öz şahidliyini təqdim edir. Lakin bu, ayədə oxuduqlarımızla uyğun gəlmir, çünki İsa - aleyhissələm - çox gözəl bilir ki, həm özü insanların arasında ikən, həm də onlardan ayrıldıqdan sonra onların üzərində həqiqi nəzarətçi Allahdır. Lakin bununla belə öz dönəmində öz şahidliyini təqdim etməkdədir.

Üstəlik Quran bizə xəbər verir ki, Allah insanların üzərində Öz hüccətini peyğəmbərləri vasitəsilə tamamlamışdır. O – cəllə cələluhu – buyurur: "Müjdə verən və xəbərdar edən peyğəmbərlər (göndərdik ki,) peyğəmbərlərdən sonra insanların Allaha qarşı bir bəhanəsi qalmasın. Allah qüdrətlidir, hikmət sahibidir."[4:165] Əgər peyğəmbər vasitəsi ilə Allahın insanlara təbliğ etdikləri kifayət etməsəydi, yəni hüccətin tamamlanması üçün imamların da bir rolunun olması şərt olsaydı o zaman peyğəmbərlərdən sonra insanların Allaha qarşı bir bəhanəsi qalacaqdı. İnsanların bəhanəsinin qalmaması o deməkdir ki, Allah peyğəmbərləri ilə Öz hüccətini iqamə etmiş, haqqı insanlara çatdırmış və onlara heç bir üzr tərk etməmişdir. Möminlərin əmirinə nisbət edilən bir xütbədə dediyi sözlər də bu mənadadır: "Allah peyğəmbərlərini onlara xas etdiyi vəhylə göndərdi və onları öz bəndələri üzərində hüccət qərar verdi ki, onlara üzrlər buraxaraq bəhanə gətirməyə haqq qazandırmasın! Beləliklə də səmimi dillə onları haqq yoluna dəvət etdi."[303] Yenə bir başqa ayədə buyurur: "Şübhəsiz ki, elçi göndərilən ümməti və göndərilmiş elçiləri sorğu-suala tutacağıq."[7:6] Bu ayədə Allah - cəllə cələluhu - insanları iki qismə ayırır; göndərdiyi

---

[303] ər-Radi, "Nəhcul-Bəlağa", 2/27;

peyğəmbərlər və peyğəmbərlərin göndərildikləri ümmətlər. Burada Əgər imamların ümmət üzərində hüccət və peyğəmbərin uzantısı kimi bir rolu olsaydı o zaman Allahın onları da sorğuya çəkməsi lazım idi, halbuki Allah – cəllə cələluhu – ayədə imamları qeyd etmir.

Bütün bu qeyd etdiklərimiz israrla isbat edir ki, nə ümumilikdə imamət haqqında, nə də xüsusilikdə hansısa imam haqqında Allahın kitabında hər hansı bir dəlil yoxdur. Bu yöndə qarşıya qoyulan dəlillərin hamısı təəssüf ki, tapmaca xatakterli dəlillərdir, yaxud da açıq-aşkar dəlilətindən uzaqlaşıb imamət mənasına həml etmək üçün hədislərə ehtiyac duyan ayələrdir.

# İMAMƏT VƏ SÜNNƏ

Məlumdur ki, Qurandan sonra müsəlmanlar üçün qaynaq sünnətdir. Həmçinin məlumdur ki, sünnətdə gəlmiş hər bir hədis və xəbər hər bir mövzuda hüccət deyildir. Xüsusilə də əqidənin təməllərində sünnət kitablarında qeyd edilən hər bir xəbər dəlil olmaz. əş-Şərif əl-Murtəda hədislərə arxalanan hədis əhli haqqında danışarkən deyir: "Məgər görmürsənmi ki, bu şəxslərin özləri tövhid, ədalət, peyğəmbərlik və imamət kimi dinin əsaslarında əhəd xəbərlərlə dəlil gətirirlər?! Halbuki, hər bir ağıllı insana məlumdur ki, bu cür xəbərlər bu mövzularda höccət sayılmaz."[304] Şiələrdə fəqihlərin ustadı sayılan Murtəda əl-Ənsari də deyir: "əş-Şeyx (ət-Tusi)nin 'əl-Uddə' adlı kitabının zahirindən görünən budur ki, dinin əsaslarında əhəd xəbərlərə əsaslanmağın caiz olmaması - hədis əhlindən bəzi qafillər istisna olmaqla - ittifaq məsələsidir. "əs-Sərair" kitabında əs-Seyyid əl-Murtəda'dan hekayət olunan rəy budur ki, bu məsələdə əslən heç bir ixtilaf yoxdur."[305] Həmçinin əş-Şəhid əs-Səni yazır: "Çünki əhəd xəbər zənnidir, onunla zənni şəriət hökmlərində əməl etmək barəsində ixtilaf ediblər, o zaman etiqadi elmi məsələlərdə necə olmalıdır?!"[306] əş-Şəhid əs-Səni'nin sözlərinin mənası budur ki, əgər zənni əhkam məsələlərində əhəd xəbərlərlə əməl etmək şiə alimləri arasında ixtilaflıdırsa o zaman qətiyyət tələb edən təməl etiqadi məsələlərdə əhəd xəbər necə hüccət ola bilər ki?! Şübhəsiz ki, tövhid və nübuvvət kimi fundamental etiqad məsələlərinin yalnız əhəd xəbərlər ilə sabit ola biləcəyini təsəvvür etmək mümkün deyildir. Yalnız əhəd xəbərlə sabit olmuş istənilən etiqad heç bir şəkildə tövhidə və ya nübuvvətə bərabər tutula bilməz, heç namaz, oruc, zəkat və həcc kimi ibadətlərə də bərabər tutula bilməz. Beləliklə də sünnətdən imamətlə bağlı gətirilən dəlillər mütləq mütəvatir və ona yaxın həddə olan xəbərlər olmalıdır.

304 əş-Şərif əl-Murtəda, "Rasəil əl-Murtəda", 1/211;

305 əl-Ənsari, "Fəraidul-Usul", 1/557;

306 "Məvsuatu əş-Şəhid əs-Səni", 12/44; "əl-Məqasid əl-Aliyyə" kitabı

Şiə alimlərindən Şeyx Əli Al Muhsin yazır ki, əl-Kuleyni'nin "əl-Kafi" kitabında "elə zəif hədislər var ki, onlara nəinki dinin üsulunda, heç dinin furuatında (əməli hökmlərində) istinad etmək düzgün deyil. Eləcə də məzhəbi və ya məzhəbin qətiyyət və yəqinliklə bilinməsi labüd olan olan üsullarını və əqidələrini isbat etmək üçün "Kafi" və digər kitablardakı - hətta səhih olsa belə - hədislərə istinad etmək doğru deyil. Yalnız mütəvatir olan, Peyğəmbərdən - sallallahu aleyhi və alih - və əhlul-beytdən olan imamlardan - aleyhimussəlam - sadir olduğu qəti bilinən hədislər istisnadır."[307]

Üstəlik bu xəbərlər mütəvatir olmaqla yanaşı həm də dəlalətində aşkar olmalıdır, gizli mənalar olmamalıdır. Əks təqdirdə ortaya çıxan nəticə bu olur ki, insanlara dinlərindəki ən önəmli məsələləri öyrətmək istəyən Xaliq bunu cümlələrin zahirində yox, batinində gizlədib. Bu isə Allahın hikmətinə müxalifdir. Ona görə də biz şiə alimi Seyyid Muhəmməd Said əl-Hakim'in bu sözləri ilə razıyıq ki, "...hakimiyyət sistemində qanunvericilik boşluğu ixtilaf, fitnə, qarşıdurma və çaşqınlığa səbəb olur ki, bu da Allah-Təalanın hikməti və bəndələrinə, xüsusilə də bu ümmətə olan mərhəməti ilə uyğun gəlmir. Xüsusilə də əvvəlki təqdimatlarda qeyd edildiyi kimi, bu ümmətin ixtilafa düşməsi yalnız haqqın dəlillərlə bəlli və açıq-aydın, gecəsi gündüzü kimi aydın olduqdan sonra baş verə bilər... Dəlillər o qədər güclü və aydın olmalıdır ki, daha əvvəl dediyimizə uyğun olaraq müsəlmanlar arasında baş verəcək ixtilaflar yalnız açıq aşkar dəlil ortaya çıxdıqdan sonra baş verməlidir."[308] Kitabımızın müqəddiməsində təqdim etdiyimiz məlumatlar arasında qeyd etdik ki, imami şiələrinə görə imamətin dəlili cəli, yəni mənası aşkar olan dəlillər olmalıdır. Ona görə də kitablarda keçən hər hədis və xəbər bu mövzuda bizim üçün əhəmiyyət kəsb etməməlidir; qarşıya qoyulan hər bir arqumentin hər şeydən əvvəl Allahın elçisindən - salləllahu aleyhi va səlləm - sabit olduğu isbat edilməli, ondan sonra isə onun tələb olunan mənaya dəlalətinin aşkar olduğu göstərilməlidir. Əks təqdirdə tələb olunan mənanı dinin üsuluna, etiqadına əsaslarına daxil etmək mənasızdır.

Onu da əlavə etməliyik ki, imamət müzakirəsində tərəflərin bir-birinə qarşı gətirdikləri dəlillər öz kitablarından yox, müxaliflərinin kitablarından və qaynaqlarından olmalıdır. Misal üçün imami şiələri sünnət əhlinə imaməti isbat etmək istədiklərində "əl-Kafi", "Təhzibul-

---

[307] Al Muhsin, "Kəşful-Həqaiq", səh: 28;

[308] əl-Hakim, "Usulul-Aqidə", səh: 209;

Əhkam" kimi şiə hədis kitablarına əsaslanmaqları doğru deyildir. Bu barədə İbn Həzm əl-Əndəlüsi deyir: "Bizim öz rəvayətlərimizlə onlara dəlil gətirməyimizin mənası yoxdur, çünki onlar bizə inanmazlar. Eyni şəkildə, onların da öz rəvayətləri ilə bizə dəlil gətirmələrinin mənası yoxdur, çünki biz də onlara inanmayacağıq. Lakin müxalif tərəflərin bir-birlərinə elə dəlillərlə sübut gətirmələri vacibdir ki, həmin dəlilləri ona qarşı gətirilən şəxs qəbul etsin – istər o dəlili gətirən şəxs ona inansın, istər inanmasın. Çünki hər hansı bir şeyi qəbul edən şəxs onun nəticələrini də qəbul etməyə məcburdur. Və ya elə bir dəlil gətirilməlidir ki, onun doğruluğu zəruri elm səviyyəsində olsun, beləliklə, həmin şəxs bunu inkar etdikdə, açıq-aşkar bir inadkarlıq və məğlubiyyət içində qalsın."[309] Əhlüs-sünnətə imaməti hədislər ilə isbat etməyə çalışan şəxs bunu mütləq əhlüs-sünnətin mötəbər kitablarında keçən və əhlüs-sünnət nəzərində mötəbər olan rəvayətlər ilə isbat etməlidir. İbn Həzmin dediklərinin bir bənzəri ilə şiə alimi Molla Əhməd əl-Ərdəbili'nin sözlərində də qarşılaşırıq. Beləki Peyğəmbərin - salləllahu aleyhi va səlləm - xəstə olduğu dönəmdə Əbu Bəkrin namazda müsəlmanlara imamlıq etdiyini dəlil gətirən sünnət əhlinə cavab verərkən əl-Ərdəbili deyir: "Üçüncü: Əgər deyilənləri qəbul etsək belə, "əs-Səhih" adlandırılan kitabda qeyd olunan hər bir məlumat zahirdə doğru görünsə də, bu, onun mütləq şəkildə bürhanla sübut olunmuş və qarşı tərəfə qarşı hüccət olduğu mənasına gəlmir. Çünki həmin məlumatın doğruluğu və nəql edənin ədalətli olması (bizim nəzərimizdə) isbat olunmamışdır. Həmin məlumatın iddia edən tərəfə görə doğru hesab olunması isə fayda verməz və onu dəlil gətirmək düzgün olmaz. Dördüncü olaraq isə, bu sadəcə bir əhəd xəbər sayılır və bu məsələ isə üsuli (etiqadi) bir məsələdir. Belə bir məsələnin əhəd xəbərlə isbat olunması isə mübahisəlidir. Hətta bu məsələnin furui (şəri əməli) olduğunu fərz etsək belə, əhəd xəbərin hüccət olmasında da mübahisə və araşdırmalar vardır. Bir çox üsulçular və başqa alimlər onunla istidlala razı deyillər. O zaman belə bir məsələni (belə bir dəlillə) necə sübut etmək olar ki?! Şiələrin bu mövzuda istinad etdikləri xəbərlərə gəlincə isə, onlar ya "Ğadir", "Mənzilə" kimi mütəvatir rəvayətlərdir, ya da elə dəlillər və əlavə göstəricilərlə yanaşıdır ki, onların inkarı mümkün deyil və ya məşhur və geniş yayılmış (müstəfiz) rəvayətlərdir. Yaxud da bu rəvayətlər müxaliflərin kitablarında qeyd olunmuşdur ki, onlar üçün bu rəvayətləri inkar etmək mümkün deyil. Belə olan halda həmin

---

[309] İbn Həzm, "əl-Fəsl fil-Miləl val-Əhva van-Nihəl", 4/78;

xəbərlər onlar üçün hüccət təşkil edir."[310] Lakin bu deyilənlər içində mütəvatir xəbərlər istisnadır, çünki mütəvatir xəbər - mütəvatirlik şərtlərini ödəyirsə - hansı kitabda keçməsindən asılı olmayaraq qəbul olunmalıdır.

Biz bu kitabımızda əl-Ərdəbili'nin sözlərini sınaqdan keçirəcəyik, mütəvatir xəbərlərin nə dərəcədə iddia olunan etiqada dəlalət etdiyini yaxından incələyəcəyik, həmçinin sünni qaynaqlarda keçən digər rəvayətlərə gə göz gəzdirəcəyik. Onu da qeyd etməliyik ki, bu gün sünni-şiə diskursunda "sünni müəlliflər" və ya "sünni kitablar" olaraq adları hallanan qaynaqlar əslində o qədər də sünni deyildir. Misal üçün İbn Əbil-Hədid əl-Mədəini və onun "Nəhcul-Bəlağa" kitabına yazdığı şərhi tez-tez əhlüs-sünnətə qarşı dəlil gətirilir və İbn Əbil-Hədid sünni olaraq təqdim edilir, hətta bəziləri onu "mötəzili sünni" adlandırır. Çox təəccüblü bir birləşmədir, çünki əhlüs-sünnət mötəziləni zəlalət firqələrindən hesab edirlər. Şiə sözünün ümumi mənasında İbn Əbil-Hədid əslində bir şiədir, çünki şiəlik təkcə on iki imam şiələrindən ibarət olmayıb. Əli bin Əbi Talib'in səhabələrin ən fəzilətlisi olduğuna, onun Peyğəmbərdən - aleyhissalətu vassələm - xəlifə olması gərəkdiyinə, səhabələrin Əbu Bəkri seçməklə xəta etdiklərinə inanan şəxs təbii ki, şiədir.[311] Yaxud da nəqşibəndi təriqətinə mənsub olan hənəfi şeyxlərindən Süleyman bin Xavacə İsmayıl əl-Qunduzi əl-Bəlxi (h. 1220-1294) və ona nisbət edilən "Yənəbiul-Məvaddə" kitabını misal göstərmək olar. Bu kitaba nəzər salan bu kitabın şiə kitabı olduğuna

---

[310] əl-Ərdəbili, "əl-Haşiyətu alə İləhiyyət əş-Şərh əl-Cədid lit-Təcrid", səh: 409;

[311] Bir çox şiə alimi İbn Əbil-Hədid'in şiəliyini görüblər və bunu təsdiq ediblər. Misal üçün Muhəmməd Təqi əl-Məclisi "Ravdatul-Muttəqin" kitabında (2/498-499) yazır: "Bu şəxslər "təfziliyyə" adlandırılırlar. Onlardan biri İbn Əbi'l-Hədid, digəri isə müşahidə olunanlara əsasən əd-Dəvani'dir – bu da onların sözlərinin əksəriyyətindən başa düşülür. Lakin onlar bəzi yerlərdə özlərinin şiə olduqlarını açıq şəkildə bildirmişlər və onlar və onlar kimilər haqqında güman edilən bu olmalıdır. Bu kimi fəzilət sahibləri zahirdə görünənə görə haqq tərəfdarı olmuşlar. Lakin batil bir hakimiyyət dövründə yaşamaqları və məşhur olmaqları onlara açıq şəkildə haqqı bəyan etməyə imkan vermədiyi üçün bu məzhəbi (yəni təfziliyyəni) zahirdə qəbul etdiklərini göstərmiş və bu vasitə ilə heç olmasa Əlinin – aleyhissəlam – digər səhabələrdən üstün olduğunu bəyan edə bilmək üçün bir yol açmışlar." Mirzä Muhəmməd Baqir əl-Musəvi əl-Xavansəri isə "Ravadatul-Cənnət" kitabında (5/19) yazır: "Şeyx, kamil alim, ədib, tarixçi, İzzuddin Abdulhəmid ibn Əbi'l-Hüseyn... İbn Əbi'l-Hədid əl-Mədaini – filosof, üsuli, mötəzilidir və İbn Əbil-Hədid olaraq tanınır, 'Nəhcül-Bəlağə'nin məşhur şərhinin müəllifidir. O, elm sahəsində dərin biliyə malik fəzilətlilərdən və mütaliəli, əhatəli araşdırma aparan nəciblərdən sayılırdı. Əhlüs-sünnət cildində olsa da İsmət və təharət əhli olan əhlul-beytə müvali idi. Firqələr arasında mühakimə zamanı isə son dərəcə ədalətli və insaflı idi." Doğru olan budur ki, İbn Əbil-Hədid sünni olmayıb, nə də imami şiələrindən olmayıb, lakin ümumi mənada şiəlik etiqadına sahib olmuş bir mötəzili idi.

şəkk etməz, çünki içində on iki imam, sonuncu imamın doğulmuş olması, Əlinin Peyğəmbərin - aleyhissalətu vassələm - vasisi olması qeyd edilir. Kitabın istifadə etdiyi qaynaqların ciddi bir hissəsi şiə kitablarıdır, xüsusi ilə əl-Bəhrani'in "Ğayətul-Məram" kitabından faydalanır, həmçinin Süleym bin Qeys'in kitabına da əsaslanır.[312] Yaxud da hicri beşinci əsrdə yaşamış əl-Qadi Əbul-Qasim Ubeydullah bin Abdilləh əl-Həskəni əl-Quraşi əl-Amiri ən-Neysəburi zikr oluna bilər. Hənəfi alimlərindən və mühəddislərindən olan əl-Həskəni'nin "Şəvahidut-Tənzil" kitabı şiə çevrələrində çox təqdir qazanıb, lakin problem budur ki, əl-Həskəni'nin bu kitabında istifadə etdiyi qaynaqlar yoğun bir şəkildə şiə qaynaqlarıdır. əl-Məclisi'nin zamanına qədər Furat təfsiri itmiş bir kitab sayılırdı, amma əl-Həskəni bu kitabında ordan xeyli nəqllər zikr edir, hətta günümüzdə Furat təfsiri çapa hazırlananda əl-Həskəni'nin bu kitabı önəmli bir referens rolu oynamışdır.[313] Bəzən məşhur əhlüs-sünnət alimi Əbu Nueym əl-Əsbəhani'dən şiə alimlər nəqllər gətirirlər və ona "Mə Nəzələ minəl-Quran fi Əli" adında bir kitab nisbət edirlər. Lakin həqiqət budur ki, əhlüs-sünnət Əbu Nueym'in belə bir kitabının olması haqqında xəbərsizdir və ona belə bir kitabı hamıdan qabaq İbnul-Bətriq əl-Hilli və sonra İbn Şəhri Əşub adlı iki şiə alimi nisbət edib. Bu cür misalların sayını artırarmaq mümkündür və adının sonunda hənəfi, şafii, maliki və ya hənbəli keçən hər kəsin əhlüs-sünnət olması şərt deyildir.[314] Hədis və rəvayət babında əhlüs-sünnətin mötəbər kitabları məlumdur və dəlil gətirildikdə həmin mötəbər kitablardan dəlillər gətirilməlidir.

---

[312] Ona görə də Ağa Buzurk ət-Tehrani "əz-Zəria" kitabında (25/290) yazır: "Müəllifin şiə olub-olmadığı bilinməsə də, o, bir qnostik idi və bu kitab şiə kitablarından sayılır." ət-Tehrani haqlıdır, çünki kitabın içindəki xəbərlər tam bir şəkildə on iki imam şiəliyinin əksidir.

[313] Furat təfsirini təhqiq etmiş Muhəmməd əl-Kazim müqəddimədə (səh: 13) yazır: "Bu kitab - yəni Furat təfsiri - bildiyimiz qədəri ilə, Alləmə əl-Məclisi dövrünə qədər alimlərdən və böyük şəxslərdən heç birinin əlində olmamışdır; yalnız əl-Hakim Əbu'l-Qasim Ubeydullah ibn Abdullah ibn Əhməd əl-Həskani – "Şəvahidü't-Tənzil" adlı dəyərli əsərin müəllifi – bu kitabın tam nüsxəsinə malik idi. O, bu kitabdan öz əsərində tez-tez nəql edir; həmçinin birbaşa nəql etməkdən əlavə Furata qədər gedib çatan isnadla da nəqllər edir. əl-Həskani həmçinin, bu gün bizə çatmayan bir sıra əsərlərə – məsələn, "ət-Təfsiru'l-Ətiq" və əl-Ayyəşinin tam sənədli təfsiri kimi kitablara – malik idi."

[314] Misal üçün Muhəmməd bin İbrahim əl-Katib şafii məzhəbinin fəqihi olaraq qeyd olunur. əs-Subki onun haqqında "ət-Tabəqat" kitabında (3/63) yazır ki, o, "ən böyük fəqihlərimizdən biridir." Bununla belə Şeyxut-Taifə ət-Tusi "əl-Fihrist" kitabında (səh: 208) deyir: "Muhəmməd ibn İbrahim ibn Yusif əl-Katib, Əbu'l-Həsən künyəsi ilə tanınırdı. Əhməd ibn Əbdun isə onun Əbu Bəkr əş-Şafii olduğunu demişdir. O, 281-ci ildə Hüseyniyyədə doğulmuşdur. Zahirdə şafii məzhəbi üzrə fiqh elmini öyrənmiş, lakin batində imamiyyə şiələrinin rəyində olub. Beləliklə, hər iki məzhəbdə fiqh alimi idi."

Şiələr Əlinin peyğəmbərdən – aleyhissalətu vassələm – sonra birbaşa xəlifəsi və imam olduğunu sübut etmək üçün bir çox rəvayəti dəlil olaraq qeyd edirlər. Biz bu kitabımızda şiələrin gətirdikləri ən əsas və "ən güclü" dəlillərə yaxından nəzər salacağıq. Onları həm səhihlikləri baxımından, həm də dəlalət etdikləri mənalar baxımından əla alacağıq, çünki yuxarıda qeyd etdiyimiz kimi arqumentin tamamlanması üçün onun sənəd baxımından sabit olması və dəlalət baxımından sağlam olması şərtdir. Əks təqdirdə belə bir arqument fiqhi bir məsələdə hüccət ola bilmədiyi halda etiqad məsələsində heç cür hüccət ola bilməz.

## Dar hədisi

Dar hədisi şiə kitablarında Əlinin imaməti üçün gətirilən ən məşhur dəlillərin başında gəlir. Bu hadisə Allahın - subhənəhu va təalə - "Ən yaxın qohumlarını qorxudub xədərbar et!" (26:214) ayəsi ilə əlaqələndirilir. Bu barədə ət-Təbəri tarix kitabında isnadı ilə rəvayət edir ki,Əli bin Əbi Talib deyib: "Bu ayə Allahın elçisinə - salləllahu aleyhi va səlləm - nazil olduqda məni çağırdı və dedi: "Ey Əli! Allah mənə ən yaxın qohumlarımı xəbərdar etməyi əmr etdi. Bu mənim ürəyimi sıxdı və bilirəm ki, onları bu məsələ ilə üzləşdirsəm onlardan xoşuma gəlməyəcək bir münasibət görəcəm. Ona görə də susdum, sonra Cibril mənə gəldi və dedi: "Ey Muhəmməd! Əgər sənə əmr olunanı etməsən Rəbbin sənə əzab verəcək." Ona görə də bizim üçün bir sa yemək hazırla, üstünə qoyunun qıçını qoy, böyük bir qabda süd doldur və sonra mənə Abdulmuttalib oğullarını topla ki, onlarla danışım, mənə əmr olunanı onlara təbliğ edim." Mənə buyurduqlarını etdim və sonra onları onun evinə dəvət etdim. Onlar həmin gün qırx nəfər idilər; bir nəfər çox və ya az. Onların arasında əmiləri Əbu Talib, Həmzə, əl-Abbas, Əbu Ləhəb var idi. Onun yanında toplandıqlarında onlar üçün hazırladığım yeməyi gətirməyimi istədi, mən də yeməyi gətirdim. Yeməyi (ortaya) qoyduqda Allahın elçisi ətdən bir parça götürdü, onu dişləri ilə parçaladı və sonra onları qabların kənarına qoydu və dedi: "Allahın adı ilə götürün!" Doyana qədər yedilər və mən onların əllərindən başqasını görmədim. Əlinin nəfsini əlində tutan

Allaha and olsun ki, əgər onlardan bir nəfər olsaydı hamısı üçün gətirdiyimi yeyib qurtarardı." Sonra (peyğəmbər) dedi: "Onlara içəcək ver!" Onlara həmin böyük qabı gətirdim, ondan da doyana qədər içdilər. Allaha and olsun ki, onlardan bir nəfər belə o qədərini tək içib qurtarardı. Allahın elçisi - salləllahu aleyhi va sələm - onlarla danışmağa başlamaq istədikdə Əbu Ləhəb onu qabaqladı və dedi: "Dostunuz sizi yaman sehirlədi!" Bunun üzərində ordakılar dağılışdılar və Allahın elçisi - salləllahu aleyhi va sələm - onlarla danışa bilmədi. Dedi? "Sabah, ey Əli! O adam məni qabaqlayıb eşitdiklərini dedi, buna görə də onlar mən danışmadan əvvəl ayrıldılar. Ona görə də bu gün etdiyin yeməyin eynisindən yenə hazırla və onları mənim yanıma topla." (Əli) dedi: "Yeməyi hazırladım, sonra onları topladım, sonra (peyğəmbər) məndən yeməyi gətirməyimi istədi, onların qarşısına qoydum. (Peyğəmbər) bir gün əvvəl etdiyi kimi etdi. Doyana qədər yedilər. Sonra dedi: Onlara içəcək gətir! Onlara həmin qabı gətirdim və hamısı doyana qədər içdilər. Sonra Allahın elçisi - salləllahu aleyhi va sələm - danışdı və dedi: "Ey Abdulmuttalib oğulları! Allaha and olsun ki, mən ərəblər arasında sizə gətirdiyimdən daha yaxşı bir şeyi öz qövmünə gətirmiş gənc birini tanımıram; sizə dünya və axirətin ən xeyirlisini gətirmişəm. Allah mənə sizi Ona dəvət etməyimi əmr edib, ona görə də sizdən kim bu işdə aranızda mənim qardaşım, vasim və xəlifəm olmaqla mənə vəzir olmağa razıdır?! Dedi: "Onların hamısı susdu. Mən isə içlərində yaşı ən kiçik, gözü ən zılıqlı, qarnı ən böyük, bacaqları ən nazik olduğum halda dedim: "Mən sənin bu işdə vəzirin olaram, ey Allahın peyğəmbəri!" Boynumdan tutdu və dedi: "Bu mənim qardaşım, vasim və sizin aranızdakı xəlifəmdir, ona görə də onu eşidib itaət edin!" Oradakılar gülərək və Əbu Talibə belə deyərək ayağa qalxdılar: "Sənə öz oğlunu eşidib itaət etməyi əmr etdi!"[315] Bu

[315] "Tərix ət-Tabəri", 2/319-321; ət-Tabəri bunun qısa versiyasını "Təhzib əl-Əsər Musnəd Əli", (3/62 (127)) kitabında rəvayət edir. Bu rəvayət isnad baxımından uydurmadır, çünki isnadındakı Əbu Məryəm Abdulğaffər bin əl-Qasim bin Qeys əl-Ənsari rafizi və yalançı olub. Əbu Davud əs-Sicistani nəql edir ki, Simək əl-Hənəfi və Abdulvahid bin Ziyad onu yalanda ittiham ediblər və əlavə edir: "Mən də şahidlik edirəm ki, Əbu Məryəm yalançıdır, çünki onunla qarşılaşmışam və rəvayət dinləmişəm…" Əli bin əl-Mədini deyir: "Hədis uydurardı." (İbn Həcər, "Lisənul-Mizən", 4/42) Üstəlik ət-Tabəri bunu şeyxi Muhəmməd bin Humeyd bin Həyyan ət-Təmimi ər-Razi'dən rəvayət edir, o isə yalan danışmaqda ittiham olunub. İbn Humeyd ər-Razi'nin öz həmyerliləri olmuş Əbu Zura ər-Razi, Əbu Hatim ər-Razi, əl-Fədl bin Abbas ər-Razi və başqaları yalançı adlandırıblar. Hətta şiə alimi Əbul-Qasim əl-Xoyi "Mucəm Ricəl əl-Hədis"də (10/27) onun siqa olmadığını deyir. İsnadında həmçinin Sələmə bin əl-Fədl ər-Razi də vardır ki, onu əksər alimlərimiz zəif hesab ediblər. İsnadında həmçinin Abdulğaffar bin əl-Qasim adlı bir başqa ravi var və o "mətruk", yəni tərk olunmuş bir ravidir. İbnul-Mədini onun haqqında deyir: "Hədis uydurardı." (bax: "əl-Kəmil fi Duafə ər-Ricəl",

hədis imami şiələrində xüsusi bir əhəmiyyətə sahibdir. Cəfər əs-Subhəni'nin dediyi kimi peyğəmbərimiz "imamət fikrinin toxumunu dar hədisində atmışdı."[316] Nuruddin əl-Həşimi də yazır ki, "dar hədisi Əlinin - aleyhissələm - mərtəbəsini bəyan etməyin ilk addımı idi və o vaxtdan başlayaraq peyğəmbər tədricən bunu izhar etməyə və islami cəmiyyətdə ona xüsusi yer verməyə çalışdı."[317] Əli əl-Hüseyni əl-Miləni isə bu hədisin peyğəmbərlik dəvətinin əvvəlində baş verdiyinə diqqət çəkir: "Sanki Allahın elçisi - salləllahu aleyhi va səlləm - eyni anda üç məsələni təbliğ etməklə əmr olunmuşdu: 1) tövhid məsələsi və Allaha çağırış, 2) rəsul olmaq məsələsi və 3) özündən sonra Əli üçün təsdiqlənmiş xilafət məsələsi."[318]

İmam Əhməd isnadı ilə rəvayət edir ki, Əli bin Əbi Talib deyib: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - Abdulmuttalib oğullarını topladı, onların arasında bütün əşirət var idi, hər biri təklikdə bütöv bir quzunu yeyə bilər, bir faraqlıq[319] südü içə bilərdi." (Əli) dedi: "Onlar üçün bir mudluq yemək hazırladı, doyana qədər yedilər. Yeməkdən isə olduğu kimi qaldı, sanki heç bir şey yeməmişdilər, sonra bir qabda süd gətirilməsini istədi, onu da doyana qədər içdilər və qabda süddən yenə də o qədər qalmışdı ki, sanki heç içməmişdilər. (Peyğəmbər) dedi: "Ey Abdulmuttalib oğulları, mən xüsusilikdə sizə, ümumilikdə bütün insanlara göndərilmişəm. Siz bu möcüzədən gördüklərinizi gördünüz, ona görə də hansınız mənə qardaşım və yoldaşım olmaqda beyət edəcək?" Onlardan heç kim qalxmadı. Onların içində yaşca ən kiçik olsam da mən ayağa qalxdım. Mənə dedi: "Otur!" Üç dəfə soruşdu və hər dəfə mən qalxdıqda "otur!" dedi. Üçüncü dəfə olduqda əli ilə mənim əlimi vurdu."[320]

---

7/18) İbn Asəkir "Tərixu Diməşq" kitabında (42/48) bu xəbəri fərqli isnadla zikr edir, lakin onun isnadındakı ravilərin bir çoxu ya məchul, ya zəifdir, ya da hədis uydurmaqda ittiham olunub. Muhəmməd bin Abbas bin Adəm əl-Basri məchuldur, Əhməd bin əl-Fədl ət-Tabəri məchuldur. Muhəmməd bin Zəkəriyya əl-Ğalləbi'ni hədis uydurmaqda ittiham ediblər. Abdulaziz bin Yəhya bin Əhməd əl-Cəludi isə Basra şəhərində imami şiələrin şeyxlərindən biri olub.

[316] "Rasəil va Məqalət", səh: 142;

[317] "Tarix əş-Şiə beynəl-Muərrix val-Haqiqa", səh: 157;

[318] əl-Miləni, "Hədis əd-Dər", səh: 23-24;

[319] Bir faraq 16 ritl tutumunda bir qabdır, bir ritl isə təxminən 400 qram edir.

[320] "Musnəd Əhməd", 2/465-466 (1371); "Tarix ət-Tabəri", 2/361-362; İsnadındakı Rabia bin Nəcid əl-Kufi məchuldur. Əbu İshaq əs-Sarifini bu rəvayəti qəsd edərək deyir ki, "Əbu Sadiq ondan münkər bir xəbər rəvayət edib." (Bax: Muğlətay, "İkməl Təhzib əl-Kəməl",

İbn Əbi Hətim ər-Razi isnadı ilə rəvayət edir ki, Əli bin Əbi Talib deyib: “Ən yaxın qohumlarını qorxudub xəbərdar et” ayəsi nazil olduqda Allahın elçisi - salləllahu aleyhi va səlləm - mənə dedi: “Mənim üçün qoyunun budundan bir salıq yemək hazırla.” Bizdə içində süd olan bir qab var idi və mənə dedi: “Onu südlə doldur!” Dediyi kimi etdim, sonra mənə dedi: “Haşim oğullarını dəvət et!” Onları dəvət etdim və o gün onların sayı qırx və ya qırx bir kişi idi. Onların içində on nəfər var idi ki, onlardan hər biri təklikdə qoyunu dərisi ilə birlikdə yeməyə qadir idi. Onlara qabda yemək gəldikdə Allahın elçisi - salləllahu aleyhi va səlləm - yeməyin başından götürdü və dedi: “Yeyin!” Onlar da doyana qədər yedilər. Yemək isə elə əvvəlki miqdarında qalmışdı, az bir qismi istisna heç azalmamışdı. Sonra süd qabını gətirdim və doyunca içdilər. Süddən geridə yenə də qalmışdı. Bitirdiklərində Allahın elçisi - salləllahu aleyhi va səlləm - danışmaq istədi, lakin onu qabaqladılar və dedilər: “Bu günkü kimi bir sehir görməmişdik.” (Həmin gün) Allahın elçisi susdu. Sonra mənə dedi:..” Daha sonra hədisdə bu hadisənin üç gün təkrarlandığı qeyd olunur, üçüncü gün “Allahın elçisi - salləllahu aleyhi va səlləm - sözündə onları qabaqladı və dedi: “Sizdən kim mənim adımdan borclarımı ödəyər və ailəmin içində mənim xəlifəm olar?” (Əli) dedi: Ordakılar susdular, hətta Abbas da susdu, çünki bunun onun da malına toxunacağından ehtiyat etdi. Abbas yaşda məndən böyük olduğu üçün mən də susdum. Sonra bir daha soruşduqda Abbas yenə susdu və mən bunu gördükdə dedim: “Mən edərəm, ey Allahın elçisi!” Dedi: “Sən!” O gün mən onların içində görünüşü ən pis olan idim, gözlərim zılıqlı, qarnım böyük, bacaqlarım nazik idi.”[321]

Yenə İmam Əhməd rəvayət edir ki, Əli deyib: “Ən yaxın qohumlarını qorxudub xəbərdar et!” ayəsi endikdə peyğəmbər - salləllahu aleyhi va səlləm - öz əhli beytini çağırdı və otuz nəfər gəldi. Yedilər və içdilər. Onlara soruşdu: “Kim mənim adımdan borclarımı və vədlərimi ödəmək, mənimlə birlikdə cənnətdə olmaq və əhlim arasında mənim xəlifəm olmaq istəyər?” Onlardan bir nəfər - (ravi) Şərik adını çəkmədi - qalxdı və dedi: “Ey Allahın elçisi, sən (səxavətdə) bir dərya olmusan, (sənin adından) bunun öhdəsindən kim gələ bilər axı?! Sonra bir daha dedi və bunu əhlu beytinə ərz etdi. Bunun üzərinə Əli dedi:

---

4/364;) Şiə alimi əl-Xoyi onun məchul olması səbəbi ilə rəvayətlərini zəif sayıb. (bax: “əl-Mufid min Mucəm Ricəl əl-Hədis”, səh: 223;)

[321] “Təfsir İbn Əbi Hətim”, 9/2826-2827;

"Mən."[322] əl-Həmməni bu sözləri əlavə edir: "Əli mənim adımdan borcumu ödəyəcək və vədlərimi yerinə yetirəcək."[323]

İbn Sad "ət-Tabəqat" kitabında isnadı ilə rəvayət edir ki, Əli deyib: "Allahın Elçisi – salləllahu aleyhi və səlləm – Məkkədə ikən Xədicəyə əmr etdi, o da onun üçün yemək hazırladı. Sonra Əliyə – Allah ondan razı olsun – dedi: "Abdulmuttalib oğullarını mənim üçün çağır." O da qırx nəfər çağırdı. Peyğəmbər Əliyə dedi: "Yeməyini gətir!" Əli dedi: "Mən onlara bir qab xörək gətirdim, ki onlardan biri belə onu təkbaşına yeyə bilərdi. Hamısı birlikdə yedilər, ta ki doyub əl çəkdilər." Sonra Peyğəmbər dedi: "Onlara içməyə bir şey ver!" Əli dedi: "Onlara bir qab su verdim ki, onlardan biri belə onu təkbaşına içə bilərdi. Hamısı ondan içdi, ta ki sirab oldular." Bu vaxt Əbu Ləhəb dedi: "Muhəmməd sizi ovsunladı!" və camaat dağılıb getdi. Peyğəmbər onları o gün yenidən çağırmadı. Bir neçə gün sonra yenə eyni cür yemək hazırladı və məni çağırıb əmr etdi, mən də onları topladım. Yemək yedilər. Sonra Peyğəmbər – salləllahu aleyhi və səlləm – onlara dedi: "Kim mənim bu işimdə mənə yardım edər və dəvətimə cavab verər, mənim qardaşım və cənnətdə yoldaşım olar?" Mən dedim: "Mən, ey Allahın Elçisi!" Həmin vaxt onların içində ən gənc və ayaqları ən nazik olan mən idim. Camaat susdu. Onlar dedilər: "Ey Əbu Talib, oğlunun halını görmürsən?" O dedi: "Qoyun, qoyun, o, əmisi oğluna xeyirdən başqa bir şey etməz."[324] Bura qədər qeyd etdiyimiz rəvayətlərin hamısı Əli bin Əbi Talib'dən gəlir və bu sənədlər ya uydurma, ya da çox zəifdir.

İbn Asəkir bu hədisi başqa bir isnadla Peyğəmbərin azadlı köləsi Əbu Rafi'dən rəvayət edir. Əbu Rafi deyir: "Rəsulullah - salləllahu aleyhi və səlləm - Abdulmuttalib oğullarını topladı. O gün onlar qırx nəfər idilər. Onların arasında elələri var idi ki, bir yaşlı qoyunu təkbaşına yeyə və bir faraq miqdarında südü içə bilərdi. Peyğəmbər onlara dedi ki, Allah elə bir peyğəmbər göndərməyib ki, onun üçün öz

---

[322] "Musnəd Əhməd", 2/225 (882); Şueyb Arnavut isnadının zəif olduğunu deyir, çünki isnadında Şərik bin Abdilləh ən-Nəxai və Abbad bin Abdilləh əl-Əsədi adlı iki zəif ravi var.

[323] "Fədailus-Sahabə", 1108

[324] Ibn Sad, "ət-Tabəqat əl-Kubra", 1/178; Dar Sadir; İsnadında Yezid bin İyad bin Cudubə əl-Leysi var. əl-Bağdadi tarixində (16/482) və əz-Zəhəbi "Mizənul-İtidal" kitabında (4/437) qeyd edirlər ki, İmam Malik onun yalançı olduğunu deyib. əl-Buxari "ət-Tərix əl-Kəbir" kitabında (3296), İbn Əbi Hətim "əl-Cərh vat-Tədil" kitabında (1192) onun "münkərul-hədis" olduğunu deyirlər. ən-Nəsəi "əd-Duafə val-Mətrukin" kitabında (647) və əd-Dəraqutni "əl-İləl" kitabında (13/394) onun "mətruk", yəni tərk olunmuş ravi olduğunu deyirlər. Şiə alimi əl-Əmini özü "əl-Ğadir" kitabında (5/272) bu ravi haqqında yazır ki, "yalançıdır, hədis uydurur."

ailəsindən bir qardaş, bir vəzir, bir varis, bir vəsi, borc və vədlərini yerinə yetirən, vəfatından sonra onun adından çıxış edən birisi olmasın. Sonra onlara səslənərək buyurdu: Bəs sizdən kim mənim bu işimdə mənə tabe olacaq ki, mənim qardaşım, vəzirim, vəsim, borclarımı ödəyən və vədlərimi tamamlayan olsun? Bu zaman Əli ibn Əbi Talib – o zaman onların arasında yaşca ən kiçik idi – ayağa qalxaraq "Mən, ey Allahın elçisi!" dedi. Peyğəmbər ona "Otur!" buyurdu. Sonra onlara bir yaşlı qoyunun əti və bir faraqlıq süd gətirildi. Hamısı doydu, yemək və içməkdən artıq da qaldı. İkinci gün Peyğəmbər yenə eyni sözləri onlara təkrar etdi və dedi: Ey Abdulmuttalib oğulları! İslamda başlar olun, quyruqlar olmayın! Sizdən kim mənə beyət edəcək ki, mənim qardaşım, vəzirim, vəsim, borcumu ödəyənim və vədlərimi yerinə yetirənim olsun? Yenə Əli ayağa qalxdı və "Mən!" dedi. Peyğəmbər bir daha "Otur!" buyurdu. Üçüncü gün də eyni sözləri təkrar etdikdən sonra Əli qalxıb Peyğəmbərə beyət etdi. Rəsulullah onun ağzına tüpürdü. Bu zaman Əbu Ləhəb, "Vay halına! Qohumuna etdiyin iş necə də pis oldu! O sənin dəvətinə icabət etdi, sən isə onun ağzını tüpürcəklə doldurdun!" deyə narazılıq etdi."[325] Bunun arxasınca daha bir rəvayətə yer verir və bu rəvayətdə Əbu Rafi deyir: "İnsanlar Əbu Bəkrə beyət etdikdən sonra oturmuşdum. Bu zaman Əbu Bəkrin Abbasa belə dediyini eşitdim: "Səni Allaha and verirəm söylə; doğrudurmu ki, Rəsulullah – sallallahu aleyhi və səlləm – Abdulmuttalib oğullarını və onların övladlarını topladı sən də onların arasında idin və sizləri Qureyşdən ayrı tutaraq bir yerə topladı və sizə belə dedi: 'Ey Abdulmuttalib oğulları! Allah elə bir peyğəmbər göndərməyib ki, onun üçün öz ailəsindən bir qardaş, bir vəzir, bir vəsi və öz əhlində bir xəlifə seçməmiş olsun. Bəs kim sizin aranızdan mənim qardaşım, vəzirim, vəsim və əhlim arasında xəlifəm olmaq üçün ayağa qalxıb mənə beyət edər?' Amma sizin aranızdan heç kim ayağa qalxmadı. Sonra buyurdu: 'Ey Abdulmuttalib oğulları! İslamda baş olun, quyruq olmayın! Allaha and olsun ki, sizdən bir nəfər qalxacaq, ya da bu iş başqasına veriləcək, o zaman isə peşman olacaqsınız!' Bu zaman sizin aranızdan yalnız Əli ayağa qalxdı və ona, Rəsulullahın ona şərt qoyduğu və dəvət etdiyi hər şeyə beyət etdi. Rəsulullahın ona bunu etdiyini bilirsənmi?" Abbas dedi:

[325] İbn Asəkir, "Tərixu Diməşq", 42/49-50; İsnadında çox sayda məchul ravidən savayı İbn Uqdə kimi problemli, ittiham olunmuş ravi də var.

"Bəli, bilirəm."" [326] Bu, Əbu Rafi'nin rəvayət etdikləridir və hər iki isnad etibarsızdır.

Bu xəbəri həmçinin əl-Bəra bin Azib'dən də rəvayət ediblər. əs-Sə'ləbi təfsirində rəvayət edir ki, əl-Bəra deyib: "Peyğəmbərə – sallallahu aleyhi və səlləm – "ən yaxın qohumlarını qorxudub xəbərdar et" ayəsi nazil olduqda Rəsulullah – sallallahu aleyhi və səlləm – Abdulmuttalib oğullarını bir yerə topladı. Onlar o gün qırx nəfər idilər; onların hər biri bir qoca qoyunu yeyəcək, bir qab dolusu südü içəcək qədər iştahlı idi. Əliyə – radıyallahu anh – dedi ki, bir qoyun budundan yemək bişirsin və onu qovurma kimi hazırlasın. Sonra buyurdu: "Yaxınlaşın, Bismillah deyin." On nəfər-on nəfər yaxınlaşdılar və doyunca yeyib qayıtdılar. Sonra bir qab süd gətirildi, Peyğəmbər – sallallahu aleyhi və səlləm – ondan bir qurtum içdi və buyurdu: "Allahın adını çəkib için!" Hamısı içdi və doydu. Bu zaman Əbu Ləhəb onları qabaqlayıb dedi: "Bu, adamın sizə sehridir!" Peyğəmbər – sallallahu aleyhi və səlləm – o gün susdu və heç nə demədi. Ertəsi gün eyni yemək və içki ilə onları yenidən dəvət etdi. Yeməkdən və içkidən sonra Rəsulullah – sallallahu aleyhi və alih – onları qorxudaraq belə buyurdu: "Ey Əbdülmuttəlib oğulları! Şübhəsiz ki, mən Allah tərəfindən sizə xəbərdarlıq edən və müjdə verənəm. Heç birinizin gətirmədiyi şeyi sizə gətirmişəm: dünya və axirət səadətini. İslamı qəbul edin, itaət edin ki, hidayət tapasınız. Kim mənimlə qardaş olacaq, kim mənə kömək edəcək, kim mənim vəlim, vəsim, məndən sonra ailəmdə xəlifəm və borclarımı ödəyənim olacaq?" Qohumlar susdular. Peyğəmbər bu sözlərini üç dəfə təkrar etdi, hər dəfə hamı susdu, yalnız Əli – radıyallahu anh – "Mən!" dedi. Peyğəmbər – sallallahu aleyhi və alih – buyurdu: "Sən!" Qohumlar qalxıb getdilər və yolda Əbu Talibə belə dedilər: "Oğluna itaət et, artıq o səni özünə əmirlər təyin etdi!"[327] Bu rəvayət də isnad baxımından çox zəifdir.

əl-Bələzuri "Ənsəbul-Əşraf" kitabında Abdullah bin Əbil-Həkəm'in belə dediyini rəvayət edir: "Peyğəmbərə – sallallahu aleyhi və səlləm – "ən yaxın qohumlarını qorxudub xəbərdar et!" ayəsi nazil

---

[326] Eyni mənbə, 42/50; İsnadındakı Muhəmməd bin İbrahim bin Cəfər əl-Kurdi və Cəfər bin Abdullah əl-Muhəmmədi və Ömər bin Əli bin Ömər bin Əli bin əl-Hüseyn də məchul ravilərdir. İsnadında həmçinin İbn Uqdə yer alır ki, onun haqqında alimlərimiz ixtilaf edib, onu ağır işlərdə ittiham edənlər olub.

[327] "Təfsir əs-Sə'ləbi", 20/127-128; İsnadındakı Musa bin Muhəmməd bin Əli bin Abdilləh və Zəkəriyyə bin Meysərə məchul ravilərdir, əs-Sələbi'nin şeyxi İbn Fəncəveyh isə münkər xəbərlər rəvayət etməklə tənqid olunub. Sabah bin Yəhya əl-Muzəni isə zəif ravidir.

olduqda bu ona ağır gəldi və qəlbi sıxıldı. Bir ay və ya bir qədər ondan az müddət evində oturub susdu. Onun bu halını görən bibisi və digər yaxın qadın qohumları, onun xəstələndiyini güman edərək, onu ziyarətə gəldilər. Peyğəmbər – sallallahu aleyhi və səlləm – onlara belə dedi: “Heç bir xəstəliyim yoxdur. Sadəcə, Allah mənə yaxın qohumlarımı qorxudub xəbərdar etməyi əmr edib. Mən də istəyirəm ki, Abdulmuttəlib oğullarını yığıb onları Allaha çağırım.” Qadınlar dedilər: “Onları çağır, amma Abdul-‘Uzzanı – yəni Əbu Ləhəbi – aralarına qatma, çünki o səni qəbul etməyəcək.” Sonra otaqdan çıxdılar və dedilər: “Biz sadəcə qadınıq.” Ertəsi gün Peyğəmbər – sallallahu aleyhi və səlləm – Abdulmuttəlib oğullarına xəbər göndərdi. Onlar gəldilər və onlarla birlikdə Abduмənaf oğullarından olan digər adamlar da vardı. Cəmi qırx beş nəfər idilər. Əbu Ləhəb tələsik gəlib ilk çatdı, çünki güman edirdi ki, Peyğəmbər – sallallahu aleyhi və səlləm – qohumların sevmədiyi şeylərdən əl çəkib onların xoşuna gələcək bir şey söyləyəcək. Hamı bir yerə toplandıqda Əbu Ləhəb sözə başladı və dedi: “Bunlar sənin əmilərin və əmioğlanlarındır. İndi nə deyəcəksənsə, de, amma bu namaz məsələsini bir kənara qoy. Bil ki, bütövlükdə ərəblərə qarşı qoymağa qövmünün gücü çatmaz. Sənə qarşı çıxacaq ilk insanlar sənin ailən və qohumların olacaq. Əgər bu işdən əl çəkməzsənsə, qoy səninlə biz vuruşaq, bu bizim üçün başqa qəbilələrin sənə hücum etməsindən daha asandır. Ey qardaş oğlu! And olsun ki, mən qohumlarına sənin gətirdiyin şeydən daha pisini gətirən birini görməmişəm!” Bu sözlərdən sonra Peyğəmbər – sallallahu aleyhi və səlləm – susdu və o məclisdə heç nə demədi. Bir neçə gün keçdi. Əbu Ləhəbin bu sözləri onu çox təsirləndirdi. O vaxt Cibril nazil oldu və Allahın əmrinə itaət etməsini buyuraraq onu təşviq etdi. Bunun ardından Peyğəmbər – sallallahu aleyhi və səlləm – onları yenidən bir araya topladı və belə buyurdu: “Həmd olsun Allaha! Onu həmd ilə yad edirəm, ondan kömək istəyirəm, Ona iman gətirirəm, Ona təvəkkül edirəm. Şəhadət verirəm ki, Allahdan başqa ilah yoxdur, Onun tayı-bərabəri yoxdur. Həqiqətən, Raid öz əhlini aldatmaz.”[328] And olsun Allaha, əgər yer üzündəki bütün insanlara yalan danışsaydım belə, sizə yalan danışmazdım. Əgər başqalarını aldatsaydım belə, sizi aldatmazdım. And olsun O Allaha ki, Ondan başqa heç bir tanrı yoxdur – mən Allahın Rəsuluyam; xüsusilə sizə, ümumilikdə isə bütün insanlara göndərilmişəm. And olsun Allaha,

---

[328] Bu, ərəblərdəki atalar sözündən biridir. Raid ərəblərdə öz qövmü tərəfindən heyvanların otlaması üçün otlaq axtarmaq üçün göndərilən şəxsdir. Bu, bir qövm tərəfindən etibar edilmiş şəxsin öz qövmünə yalan danışmayacağını ifadə edir.

siz necə yatırsınızsa, eləcə də öləcəksiniz; necə oyanırsınızsa, eləcə də dirildiləcəksiniz. Və əməl etdiklərinizin hesabı sizdən soruşulacaq. Yaxşılıq edənə yaxşılıqla, pislik edənə pisliklə qarşılıq veriləcək. Həqiqətən də, bu əbədi Cənnət və əbədi Od məsələsidir. Və siz, bu xəbərdarlığın ilk ünvansınız.” Bunun üzərinə Əbu Talib dedi: “Sənin yardımına və səni dəstəkləməyə bizim qədər şad olan yoxdur. Sənin nəsihətini qəbul etməyə və sözünü təsdiqləməyə bizdən daha artıq meyilli olan yoxdur. Budur, sənin əmioğulların buradadır – bir araya toplaşıblar. Mən də onlardan biri olsam da, and olsun Allaha, mən onların arasında sənin istədiyin şeyə ən tez yönələnəm. Odur ki, sənə əmr olunan şeyi yerinə yetir! And olsun Allaha, mən yaşadığım müddətcə səni qoruyacağam, sənin müdafiəndə olacağam. Amma etiraf edirəm ki, özümə Abdulmuttalibin dinini tərk etməyə razılıq verə bilmirəm. O necə öldüsə, mən də onun yolu ilə öləcəyəm.” Sonra qohumlar da yumşaq və anlayışlı sözlər dedilər, istisna olaraq Əbu Ləhəb dedi: “Ey Abdulmuttalib oğulları! Bu, and olsun Allaha, böyük bir rüsvayçılıqdır. Onun (Muhəmmədin) əlini durdurun, yoxsa bir başqası onu durduracaq! Əgər onu tərk etsəniz və müdafiəsiz qoysanız, zəlil olarsınız. Əgər onu müdafiə etməyə qalxsanız, qətlə yetirilərsiniz!” Əbu Talib isə bu sözlərə belə cavab verdi: “And olsun Allaha, biz yaşadığımız müddətcə onu qoruyacağıq!”[329] Bu xəbər mürsəl olmaqdan ziyadə isnadında Əbu Bəkr bin Əbi Səbura var və o, hədis uydurmaqda ittiham olunub. İmam Əhməd onunla bağlı deyərdi: “O, yalan danışar və hədis uydurardı.”[330] İbn Hibban da qeyd edir ki, “sabit ravilərdən uydurma xəbərlər rəvayət edərdi.”[331] Üstəlik isnadında Ömər bin Abdillah əl-Qisi var və o, məchuldur. Muhəmmər bin Ömər əl-Vaqidi isə tərk olunmuş ravilərdəndir.

Dar hədisi və bu hədisin müxtəlif rəvayət variantlarında müşahidə etdiyimiz bir çox problemli məqam göstərir ki, bu rəvayət nə isnad baxımından, nə də mətn baxımından dəlil ola bilməz. Hədisdə qarşılaşdığımız ilk problem budur ki, Abdulmuttalib oğullarının toplandığı həmin məclisdə qırx kişinin olduğunu iddia edir. Təbii ki, Abdulmuttalib oğullarının həmin gün qırx nəfər olmasının reallığı bir sual olaraq qarşımızda durub. Biz bilirik ki, Abdulmuttalibin oğullarından altısı artıq vəfat etmişdi, yalnız Həmzə, Abbas, Əbu Talib və Əbu Ləhəb sağ idi. Peyğəmbərin əmilərindən əl-Muqavvim hələ

---

[329] əl-Bələzuri, “Ənsəbul-Əşraf”, 1/286-288 (rəq: 116)

[330] “əl-İləl va Mərifətu ər-Ricəl”, (1193); İbn Əbi Hətim, “əl-Cərh vat-Tədil”, 7/306;

[331] İbn Hibban, “əl-Məcruhin”, 3/147;

"peyğəmbərlik anından altı il əvvəl ölmüşdü." Digər əmisi Həcəl isə "əl-Muqavvim'dən bir il kiçik idi və ondan bir il sonra öldü." Digər qardaşı Haris isə "Allahın elçisinin - salləllahu aleyhi va səlləm - doğumundan əvvəl ölmüşdü, qardaşlar içində ən böyüyü idi." Digər əmisi Qusəm bin Abdilmuttalib isə "balaca ikən ölmüşdü." Bir başqa əmisi Dirar gənc ikən İslamdan əvvəl vəfat etmişdi. Ğeydəq də İslamdan əvvəl, atasının ölümündən beş il sonra vəfat etmişdi.[332] əz-Zubeyr bin Abdulmuttalib isə vəfat edərkən Allahın elçisinin - salləllahu aleyhi va səlləm - hələ qırx yaşı yox idi.[333] Peyğəmbərin ən böyük əmisi Haris atası Abdulmuttalib ilə birlikdə zəmzəm quyusunu qazmaqla tanınıb, çünki o gün ondan başqa oğlu yox idi.[334] İbn Sad yazır: "Abdulmuttalib oğullarının nəsli Abbas, Əbu Talib, əl-Haris və Əbu Ləhəbdə davam edib; Abdulmuttalib'in oğullarından Həmzənin, əl-Muqavvim'in, əz-Zubeyr'in və Həcəlin uşaqları olmuşdu, lakin ölmüşdülər, digərlərinin isə uşaqları ümumiyyətlə yox idi."[335] İbn Həzm daha dəqiq bir ifadə işlədərək yazır: "Onlardan dördündən, əl-Abbas, Əbu Talib, əl-Haris və Əbu Ləhəb'dən başqa heç biri qalıcı nəsil tərk etməmişdi."[336] Əbu Talib'in dörd oğlu var idi: Talib, Aqil, Cəfər və Əli. Abbasın isə hicrətdən əvvəl yalnız üç oğlu dünyaya gəlmişdi. Onların içində ən böyüyü əl-Fədl idi. Vəda həccində peyğəmbərin - aleyhissələm - dəvəsində peyğəmbərlə birlikdə oturub gənc xəs'əmli qıza baxan və peyğəmbərin hər dəfə üzünü döndərdiyi gənc oğlan da məhz həmin bu əl-Fədl idi.[337] Onun oğullarından o gün yalnız əl-Fədl iştirak edə bilərdi, çünki ikinci oğlu Abdullah bin Abbas hicrətdən 3 il və ya 4 il əvvəl dünyaya gəlib, üçüncü oğlu Ubeydullah isə Abdullahdan bir yaş kiçik idi. Digər oğulları hicrətdən sonra dünyaya gəliblər.[338] Lakin biz əl-Fədl'in o gün orada olmadığını bilirik, çünki əl-Fədl yaş baxımından Əlidən kiçik idi və hədisdə Əli deyir ki, "mən onların arasında yaşca ən kiçik idim." Həmzə bin Abdilmuttalibə gəldikdə isə onun Məkkədə ikən heç bir oğlu olmayıb. Həmzə hicrətdən sonra Mədinədə evlənib və iki ənsarlı həyat yoldaşı olub, birindən iki,

[332] əl-Bələzuri, "Ənsəbul-Əşraf", 4/282-310; İbn Hibban, "əs-Siqat", 2/134-136;

[333] əl-Bələzuri, "Ənsəbul-Əşraf", 2/20;

[334] "Siratu İbn Hişam", 1/143; İbn Hibban, "əs-Sira ən-Nəbəviyyə va Əxbər əl-Xuləfə", 1/51;

[335] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 1/94; Dar Sadir

[336] İbn Həzm, "Cəmhəratu Ənsəbil-Arab", səh: 15;

[337] "Musnəd Əhməd", 2/ 5, 2/ 455;

[338] əl-Bələzuri, "Ənsəbul-Əşraf", 4/55; İbn Abdilbərr, "əl-İstiy'əb", 1/196;

digərindən isə bir oğlu dünyaya gəlib; Yalə, Amir və Umərə.[339] əl-Haris bin Abdilmuttalib'in oğulları isə Nəvfəl, Rabia, Əbu Sufyan, Abdullah və Umeyyə idi; Əbu Sufyan peyğəmbərimizin - aleyhissələm - süd qardaşı idi, Həlimə onların hər ikisini də əmizdirmişdi. Abdullahın adı isə Abdu Şəms idi və Allahın elçisi - aleyhissələm - hicrət etdikdə onun adını Abdullah olaraq dəyişdirdi. Əbu Ləhəbə gəldikdə onun da üç oğlu var idi. Bunlar Utbə, Uteybə və Muattib idi. əz-Zubeyr bin Abdilmuttalib'in oğullarından təkcə Abdullah bin əz-Zubeyr İslam dönəminə şahid olmuş və Allah rasulunun - salləllahu aleyhi va səlləm - vəfatından sonra hicri 13-cü ildə Əcnədeyn döyüşündə şəhid olmuşdur. Öldükdə təxminən otuz yaşı olduğunu yazırlar.[340] Belə çıxır ki, Abdullah bin əz-Zubeyr də Əlidən yaşca kiçik olub. Bütün bunları nəzərə alsaq o gün Abdulmuttalib oğullarının sayı heç iyirmi nəfər etmir.

Üstəlik rəvayətlərdə peyğəmbərin - aleyhissalətu vassələm - əhli beyti haqqında xoşa gəlməyən sözlər işlədilir. Bu hədisləri oxuyan bəzi kəslərin nəzərində peyğəmbərin əmiləri və əmisi oğulları - haqlı olaraq - acgöz insanlar olaraq təsəvvür olunur. Onlardan hər birinin diri qoyunu yeməsi, bir fəraq tutumlu südü içməsi açıq-aşkar mübaliğə ola bilər, çünki qədimdə bir kimsənin igidliyini göstərmək üçün bu cür vəsflərdən istifadə olunması normal idi. Bir fəraq süd ən aşağı hesab ilə təxminən 8 litr edir; bir nəfərin bu qədər südü içə bilməsi əlbəttə ki, bir mübaliğədir. Lakin peyğəmbərin süfrəsində onların necə sürətlə, acgözlüklə yemək yedikləri Əlinin adından bu sözlərlə ifadə olunur: "onların əllərindən başqa bir şey görmədim." Bu sözün mənası budur ki, yeyənlərin əlləri süfrənin üstündəki yeməkləri örtəcək qədər çox hərəkət edirdi. Əlinin özü - kərraməllahu vachəhu - çox çirkin şəkildə vəsf olunur. O gün Əlinin təxminən 13 yaşı olduğunu bilirik və bu yaşda bir yeniyetmənin gözü zılıqlı, yekəqarın və nazik bacaqlı biri olduğunu ağlımızda canlandırmaq belə xoşa gəlmir. Çünki qarnın böyüklüyü adətən müəyyən bir yaşı ötdükdən sonra görülən bir haldır, uşaqlarda və yeniyetmələrdə bacaqların nazikliyi ilə bərabər qarnın böyük olması tamamilə anormal bir haldır. Necə ola bilər ki, o miqdarda yeməyi bir oturuma parçalaya biləcək böyük kişilərin qarnı belə Əlinin qarnından böyük olmadı?! İsnadlarının açıq-aşkar zəifliyinə

[339] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 3/ 8, Dar Sadir

[340] İbn Abdilbərr, "əl-İstiy'əb fi Mərifətil-Əshəb", 3/905;

baxmayaraq bu cür rəvayətləri təsdiqləyən və bununla belə Əlini sevdiklərini iddia edən şiələrin halına təəccüblənmək olar.

Əlavə etmək olar ki, hədis təkcə əhlu-beyti yox, həm də peyğəmbərin - aleyhissalətu vassələm - özünü çox mənasız və mənfi bir obrazda təmsil edir. Unutmayaq ki, peyğəmbərlərin əsas missiyası bəşəriyyətə tövhid inancını təbliğ etmək olub və bunun üçün Allah insanların içərisindən qövmünün ehtiramını və etibarını qazanmış kəsləri seçir. Bu kəslər öz danışıqlarında və atdıqları addımlarında dövrünün və yaşadığı cəmiyyətin ən yüksək əxlaq normalarını özündə əks etdirir. Belə bir kimsənin ehtirama, sağlam düşüncəyə, ciddiyyətə müxalif olacaq təklifləri öv qövmünə verməsi və ya onların qarşısında bu cür dəyərləndirilə biləcək hərəkətlər etməsi risalət hikməti ilə heç cür uyğun gəlmir. Burada dayanıb düşünmək lazımdır ki, Abdulmuttalib oğulları hələ tövhidi və nübuvvəti qəbul etmədikləri halda onlara necə xilafət məqamına itaət təklif edilə bilər? Peyğəmbərliyini qəbul etdirə bilmədiyi bir qövmə onların övladlarından kiçik bir uşağa itaət etməyi əmr etmək peyğəmbərin qövmü yanındakı ehtiramına zərər gətirmirmi, dəvəti zəiflətmirmi? Bunun arxasında hansı hikmət dura bilər ki?! Muhəmməd Asif əl-Muhsini də təsdiq edir ki, "o gün Əli balaca uşaq idi, ehtilam yaşına çatmamışdı..."[341] Həddi-büluğa çatmamış bir uşağı qövmün ağsaqqalları üzərində xəlifə təyin etmək, onların bunu qəbul etməsini gözləmək heç bir şəkildə hikmətli bir addım hesab edilə bilməz. Ona görə də əmiləri, balaca bir uşağın qövmün ağsaqqallarından olan Əbu Talibin üzərində əmir təyin edilməsinə gülürdülər. Qeyd etməliyik ki, peyğəmbərimiz - aleyhissalətu vassələm - dəvətinin nə əvvəlində, nə də sonunda Qureyş qəbiləsinin böyüklərini öz məqamlarından endirmək iradəsi göstərməmişdi, əksinə onların öz qəbilələri üzərindəki təsirini və avtoritetlərini təsdiqləmişdi. Bunun misalı olaraq Hüneyn döyüşündən sonra əldə edilən qənimətlərdən xeyli bir hissəsini Sufyan bin Hərb, Safvan bin Umeyyə, Suheyl bin Amr kimi Qureyşin böyüklərinə verdi.[342] Həmçinin peyğəmbərin əmisi Abbas ona Məkkənin fəthindən əvvəl dedi: "Ey Allahın elçisi, Əbu Sufyan bu fəxri sevən biridir, onun üçün bir şeyi xüsusiləşdirsən yaxşı olar." Dedi: "Bəli! Hər kim Əbu Sufyanın evinə sığınarsa o əminlikdədir."[343] Urva bin əz-Zubeyr qeyd edir ki, Allahın elçisi Məkkəyə daxil olarkən demişdi: "Kim Əbu

[341] "Siratul-Haqq", 3/208;

[342] "Musnəd Əhməd", 18/253-254;

[343] "Sünən Əbi Davud", 3021;

Sufyanın evinə sığınarsa əminlikdədir. Kim Həkim bin Huzeymin evinə daxil olarsa əminlikdədir. Kim Budeyl bin Varqa'nın evinə daxil olarsa əminlikdədir."[344] İslamın ən güclü olduğu vaxtlarda peyğəmbərimiz - salləllahu aleyhi va səlləm - dəvətin məsləhəti üçün Qureyşin böyüklərinin qürurunu əzmək istəmirsə, əksinə onların öz qəbilələrində oynadıqları rolu təsdiqləyirsə, İslamın hələ təzəcə dəvətə başladığı bir ərəfədə, ən zəif vaxtında peyğəmbərin Qureyşin böyüklərinə 13 yaşına təzəcə basmış bir uşağa itaət etməklərini əmr etməsi necə qəbul edilə bilər?! Ərəblərdə şərəf və fəxr ilə tanınmış bu kəslər Muhəmmədin - salləllahu aleyhi va əlihi va səlləm - Allahın göndərdiyi bir elçi olduğunu qəbul etmədikləri halda onlara kiçik bir uşağın imamlığını qəbul etməklərini necə əmr etmək olar?!

Bu hədisdə başqa bir problem hədisin imami şiələrdəki imamət inancı ilə bir çox baxımdan uyğun gəlməməsindədir. Əgər hədis və içindəki məlumatlar səhihdirsə bu o deməkdir ki, peyğəmbər - aleyhissalətu vassələm - özünün vəziri, vasisi, varisi olmaq işini bir nəfərə yox, hamıya təklif etmişdi. Bunun nəticəsi olaraq demək olar ki, o məclisdə iştirak edənlərdən iki və ya üç nəfər təkliflə razılaşsaydılar imamət, vasilik məqamı onların hamısına aid olmalı idi. Bu problemə şiə alimləri cavab verməyə çalışıblar. Şeyx Muhəmməd Həsən əl-Muzaffər "Dəlailus-Sidq" kitabında yazır ki, "Allah - subhənəhu - və elçisi - salləllahu aleyhi va səlləm - bilirdilər ki, Əlidən başqa heç biri peyğəmbərə cavab verməyəcəkdilər, ona kömək etməyəcəkdilər. Beləliklə də bu (təklif, Əlinin) imamlığını təsdiqləmək və qövmünə hüccət iqamə etmək babındandır. Ona görə də cavab verənlərin sayının birdən çox ola biləcəyini fərz etmək doğru deyildir. Belə bir hal doğru olsaydı və baş versəydi belə, peyğəmbər - aleyhissələm - onlardan ən üstün və ən layiq olanı təyin edəcəkdi."[345] Cəfər Murtəda əl-Amili burada Mehdi ər-Ruhəni'yə istinad edərək ikinci bir yanaşmaya yer verir və deyir: "Xitab onlardan yalnız birinə yönlənmiş ola bilər, ona görə də peyğəmbər onlara soruşdu: "hansınız mənə dəstək… olar?" Onlardan ən birinci cavab verən peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - vədinə layiq olur və birdən çox insanın cavab verməsi ehtimalı çox uzaqdır, örfən bu ehtimala əhəmiyyət verilmir. Xüsusilə də zərərli olan eyni anda birdən çox adamın cavab verməsidir, bu ehtimal isə daha uzaqdır. Bütün bunlarla yanaşı o - salləllahu aleyhi va əlihi - yalnız birinin cavab verəcəyini

---

[344] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 6/9; Xanəci

[345] əl-Muzaffər, "Dəlailus-Sidq", 2/236;

bilirdi."[346] Bu cavablardan anlaşılan budur ki, peyğəmbər - aleyhissalətu vassələm - onsuz da kimin özündən sonra imam və vasi olacağını bilirdi, bu məqamı Abdulmuttalib oğullarına təklif etməsi sadəcə olaraq onların üzrünü kəsmək, onlara hüccət iqamə etmək üçün idi. "Ey Abdulmuttalib oğulları! İçinizdə Əlidən başqa heç kimə bu məqamın nəsib olmamasının səbəbkarları özünüzsüz, çünki sizə bu məqam ərz olundu, amma siz təklifə müsbət cavab vermədiniz." Kimsə düşünə bilər ki, əl-Muzaffər və əl-Amili'nin gətirdikləri izahlar tam qənaətbəxş olmasa da tam bir fiasko da sayılmaz. Lakin burada diqqətdən yayınan məqam budur ki, şiələrdə imam məqamı peyğəmbər məqamı ilə ekizdir: daha əvvəl də bu barədə yazdığımız kimi imami şiələrinə görə imamlıq ilahı bir təyinatdır. Peyğəmbərlik məqamını insanlar öz əməyi və səyi ilə qazana bilmədikləri kimi imamlıq məqamında da insanın özünün onu qazanması mümkün deyildir. Şiələr inanırlar ki, peyğəmbərləri Allah seçdiyi kimi imamları da Allah - cəllə cələluhu - seçir. Bunu biz əl-Kafi kitabında keçən rəvayətdə də oxuyuruq: "İmam zamanın nadiridir, heç kim ona yaxınlaşa bilməz, heç bir alim ona bərabər ola bilməz, onun əvəzi, misli və bənzəri yoxdur, fəzilətin hamısı ona məxsusdur, bunda onun özünün istəyi və qazancı olmaz, əksinə bu, fəziləti verən Allahın xüsusilə seçməsi ilə olur."[347] Bu barədə Muhəmməd Baqir əs-Sadr yazır: "Mərce(ye-təqlid) o kəsə deyilir ki, o, bəşəri çalışqanlıq və uzun bir əziyyət keçməklə İslam və onun qaynaqları haqqında canlı, əhatəli və dinamik bir anlayış qazanmış biridir…Beləliklə də peyğəmbərlik və imamlıq məqamlarından fərqli olaraq mərceyilik məqamını ciddi bir çalışma və Allah üçün xalis bir niyyət ilə qazanmaq mümkündür, amma peyğəmbərliyə və imamətə gəldikdə isə bu ikisi Allah ilə peyğəmbər və imam arasında olan rəbbani bir əlaqədir və bu əlaqəni səy, zəhmət və tərbiyə ilə əldə etmək mümkün deyildir."[348] əş-Şərif əl-Murtəda yazır: "Bizim rəyimiz budur ki, imamlıq (o məqama) layiq olmaqla olmur, risalət də bunun kimidir."[349] Kəməl əl-Heydəri də eyni mənanı təsdiqləyir və deyir: "İmamlıq, insanın öz zəhməti ilə çata biləcəyi kəsbi bir məqam deyildir, əksinə o, Allahdan olan bir əhddir ki, onu yalnız

---

[346] əl-Amili, "əs-Sahih min Siratil-İmam", 3/67;

[347] əl-Kuleyni, "əl-Kafi", 1/201;

[348] əs-Sadr, "əl-İsləm Yəqud əl-Həyat", səh: 133; "əl-Məcmua əl-Kəmilə li Muəlləfət əs-Seyyid Muhəmməd Baqir əs-Sadr", 12/133;

[349] əl-Murtəda, "əş-Şəfi fil-İməmə", 1/326;

zalım olmayana əhdi-peyman edir."[350] Bir məqamın kəsbi olması insanın onu öz əməlləri və çalışqanlığı ilə qazana bilməsi deməkdir. İmam məqamının kəsbi olmaması on iki imam şiələrində müsəlləm bir məsələdir və bu nöqtəni isbat etmək üçün sitatları artırmaq mənasızdır. Bu nöqtəni anladıqdan sonra bura daha bir nöqtəni əlavə etmək lazımdır və əslində əl-Heydəri'dən nəql etdiyimiz sitatın sonunda bu nöqtə ələ alınır. Beləki imamlıq məqamı nəinki kəsbi deyildir, hətta Allahın Öz fəzli ilə istədiyi şəxslərə əta etdiyi yüksək bir məqam olsa da onu zalımlara verməz. Şiələr bu nöqtədə Allahın - təbərakə va təalə - İbrahim peyğəmbərə dediyi "zalımlar Mənim əhdimə nail ola bilməzlər"[2:124] sözlərinə istinad edirlər. Şiə alimlərinə görə ömründə bir dəfə də olsun Allaha şərik qoşmuş kimsə bu ayədə murad olunan "zalımlar" qrupuna girir. əl-Alləmə əl-Hilli "Minhəc əl-Kəramə" kitabında bu ayəni dəlil gətirdikdən sonra yazır ki, "peyğəmbər - salləllahu aleyhi va əlihi va səlləm - zühur edənə qədər üç (xəlifənin) kafir olmasında, bütlərə ibadət etməsində şəkk yoxdur."[351] Eynilə şiə alimi İbn Rüstəm ət-Tabəri kitabında eyni ayəni qeyd edir və Əbu Bəkrin imamlığa layiq olmadığını İslamdan əvvəl bütlərə ibadət etmiş olması ilə izah edir. Bir başqa yerdə isə yazır: "(Bir zaman İbrahim demişdi:..) "Məni və oğullarımı da bütlərə ibadət etməkdən uzaq tut!" Sonra dedi: "... və nəslimizdən də Sənə təslim olan bir ümmət çıxart!" və sonra dedi: "zalımlar mənim əhdimə nail ola bilməzlər." Beləliklə də zalımın halına nəzər saldıq və gördük ki, ayə zalımı bütə ibadət edən olaraq təfsir edir. Hər kim bütə ibadət edibsə zülm adı onun üzərindən heç zaman ayrılmaz, Allah da zalımın imam ola biləcəyini rədd edib."[352] Şiələrdəki bu inanc imamlara nisbət etdikləri xəbərlərdən qaynaqlanır. Beləki əl-Kafi kitabında bir rəvayətdə İmam Cəfər əs-Sadiqə belə dediyi nisbət olunur: "Bütə ibadət etmiş adam bir imam ola bilməz."[353] Həmçinin ət-Tusi imlalarında Abdullah ibn Məsud'a nisbət etdiyi bir xəbərdə Allahın elçisinin - salləllahu aleyhi va səlləm - belə dediyini rəvayət edir: "Mən İbrahimin duasıyam. Dedik: "Ey Allahın elçisi! Sən necə atan İbrahimin duası oldun?" Dedi: "Allah - azzə va cəllə - İbrahimə vəhy etdi ki, mən səni insanlara imam edəcəm." İbrahim fərəhini kiçik gördü və dedi: "Ey Rəbbim,

---

[350] əl-Heydəri, "Bəhsun Həvlə əl-İmamə", səh: 159;

[351] əl-Hilli, "Minhəc əl-Kəramə", səh: 180;

[352] ət-Tabəri, "əl-Mustərşid fi İmaməti Əmir əl-Muminin Əli bin Əbi Talib", səh: 311 və 649;

[353] əl-Kuleyni, "əl-Kafi", 1/175;

zürriyyətimdə də mənim kimi imamlar var?" Allah da ona vəhy etdi ki, "Ey İbrahim, mən sənə yerinə yetirməyəcəyim bir əhd vermərəm." Dedi: "Ey Rəbbim, mənim üçün yerinə yetirməyəcəyin o əhd nədir?" Dedi: "Onu sənin zürriyyətindən zalım olanlara verməyəcəm." Dedi: "Ey Rəbbim, mənim nəslimdə zalım olan və sənin əhdinə nail olmayacaq kəslər kimdir?" Dedi: "Məndən başqasına, bir bütə səcdə edəni heç zaman imam etməyəcəm və imam olması doğru deyildir." İbrahim dedi: "Məni və oğullarımı da bütlərə ibadət etməkdən uzaq tut! Ey Rəbbim! Həqiqətən, (bütlər) insanlardan bir çoxunu azdırdı." Peyğəmbər - salləllahu aleyhi va əlihi - dedi: "Beləliklə də bu dua mənə və qardaşım Əliyə gəlib çatdı, bizdən heç birimiz bir dəfə də olsun bütə səcdə etməmişik. Buna görə də Allah məni bir peyğəmbər, Əlini isə vasi etdi."[354] Bu məsələ də imami şiələrin kitablarında məşhurdur və bunu da isbat etməyə ehtiyac yoxdur. Həmçinin isbat olunmağa ehtiyac duymayan məsələlərdən bir başqası da budur ki, şiələrə görə imam olmaq üçün nəinki bütə səcdədən uzaq olmaq, hətta ümumiyyətlə günahsız olmaq, məsum olmaq şərtdir. Bu barədə kitabımızın əvvəlində kifayət qədər məlumat verilib. Bütün bunları bir-bir nəzərdən keçirməyimiz və Dar hədisinə qayıtmağımız lazımdır. Beləliklə də hər şeydən əvvəl imamət insanın öz seçimi ilə, əməyi və zəhməti ilə qazana biləcəyi bir məqam deyildir. İkincisi isə nə zamansa bütə səcdə etmiş bir kimsə imam ola bilməz, üçüncüsü isə imam olacaq kəsin doğuşdan məsum və günahsız olması şərtdir. Bütün bunları nəzərə aldıqdan sonra Dar hədisi ilə bağlı təbii olaraq belə bir sual ortaya çıxır. Peyğəmbərin Həmzə və Abbas kimi iman etmiş və iman üzərində ölmüş əmiləri həmin məclisdə istəsəydilər belə imam olmaq imkanları yox idi. Həyatında bütə ibadət etmiş, məsum olmayan şəxslərə və insanın öz seçimi, öz istəyi, öz əməyi ilə qazanması mümkün olmayan bir məqamı təklif etmək necə məntiqli ola bilər?! Bunu hüccət iqaməsi olaraq da izah etmək heç bir əqli ölçüyə görə doğru ola bilməz. Çünki hüccət, bir qayda olaraq günah edənlərin üzrünü aradan qaldırmaq üçün tətbiq olunur. Ona görə də heç bir seçimləri və qüdrətləri olmayan bir məsələdə onları mükəlləf qılmaq görəsən şiə məzhəbinin üsul qaydalarına tərs gəlmirmi?! Cavab budur ki, belə bir təklif cəfəri məzhəbinin üsul qaydalarına müxalifdir. Beləki əşarilərdən fərqli olaraq mötəzililər və on iki imam şiələri etiqad edirlər ki, insanın taqəti olmayan bir şey ilə mükəlləf qılınması əqlən caiz deyildir və çirkindir. əl-Murtəda əş-Şərif "əz-Zəxira" kitabında bu

[354] ət-Tusi, "əl-Əməli", səh: 378-379;

məsələni açıqlayır və qeyd edir ki, "mükəlləf qılınmış kəsin, mükəlləfiyyəti ilə bağlı felləri (etmək)də ehtiyac duyduğu alətlərə/vasitələrə imkanının olması vacibdir, çünki alətdən məhrum olmaq qüdrətdən məhrum olmaqda olduğu kimi (bu halda) mükəlləf qılmağın çirkinliyində eynidir…" Daha sonra buyurur: "Mükəlləfiyyətdə riayət edilməsi vacib olan şərtlərdən biri də (feli etməkdə) sərbəst buraxılmış və maneələrin aradan qalxmış olmasıdır, çünki maneə olduqda - istər bu maneə Allahdan olsun, istər başqasından - feli etmək imkansız olur, ona görə də (feli etmək) ona imkansız olduğu halda onu mükəlləf qılmaq çirkindir…"[355] Həmçinin Əbus-Saləh əl-Hələbi yazır: "Olması vacib olan şərtlərdən biri də qul ilə qadir olduğu fel arasında sərbəstliyin olmasıdır, çünki Allah - subhənəhu - Özünün felinə və ya mükəlləfin felinə qarşı bir maneənin olduğunu bilirsə onu (o fel ilə) mükəlləf etməsi çirkin olar, çünki o felin baş verməsi imkansızdır…"[356] Bu məsələ imami şiələrinin kitablarında məşhurdur və müsəlləmdir.[357] Dar hədisində isə - şiələrin etiqadına görə - Əlidən başqa hamının imam olması üçün maneələr var idi; onların məsum olmamaqları, bütə ibadət etmiş olmaqları bu maneələrdən bəziləridir.

Bəs Əbu Talib?! Bəli, Əbu Talib'in o məclisdə iştirak etməsi və peyğəmbərə - aleyhissalətu vassələm - dəstək olmaqdan imtina etməsi məqamı bir başqa problemdir. Peyğəmbərin əmisi Əbu Talib məhz qardaşı oğluna kömək olduğu üçün, ona dəvətində bütün lazım olan dəstəyi göstərdiyi üçün Qureyş qəbiləsi tərəfindən cəfa və əziyyət gördü, lakin bununla belə dəstəyini geri çəkmədi. Bu məsələdə müsəlmanların hamısı məzhəblərindən asılı olmayaraq ittifaq ediblər. Əbu Talibin bu barədə şerləri kitablarımızda məsturdur. Bir beytdə deyir: "Allaha and olsun ki, mən torpaqda dəfn olunmadığım müddətdə hamılıqla gəlsələr də sənə çata bilməzlər. Ona görə də heç çəkinmədən işinə davam et, qəlbin rahat olsun və gözlərin işıqla dolsun!"[358] Bir rəvayətdə Abdullah bin Məsud deyir: "İslamını ilk dəfə aşkara vuran yeddi nəfər idi: Allahın elçisi - salləllahu aleyhi va səlləm, Əbu Bəkr, Ammar, anası Sumeyyə, Suheyb, Bilal və əl-Miqdad. Allahın elçisinə - salləllahu aleyhi va səlləm - gəldikdə Allah onu əmisi Əbu Talib vasitəsilə qorudu. Əbu Bəkri isə Allah onun öz qövmü

---

[355] əl-Murtəda, "əz-Zəxira fi İlm əl-Kələm", səh: 123-124;

[356] əl-Hələbi, "Təqribul-Məarif", səh: 130;

[357] Bax: ət-Tusi, "əl-İqtisad", səh: 70; əl-Bəhrani, "Qavaidul-Məram", səh: 116; əl-Hilli, "Mənəhic əl-Yəqin", səh: 384;

[358] əl-Beyhəqi, "Dəlail ən-Nubuvva", 2/188;

vasitəsilə qorudu. Digərlərinə gəldikdə isə onları müşriklər götürdülər, onlara dəmirdən halqalı paltarlar geydirdilər və onları günəşin şiddətli istisinə məruz qoydular. Bilaldan başqa hamısı onların istədiklərini dedilər. O isə Allah üçün öz canına əhəmiyyət vermədi və qövmü də onun başına gələnlərə biganə qaldı. Sonra onu xidmətçilərə verdilər, onlar da onu Məkkə küçələrində gəzdirdilər və o, "Əhədun! Əhədun!" deyib durdu."[359] Beləliklə də Əbu Talibin ilk başdan peyğəmbərimizə dəstək çıxması, onu qövmünün zülmünə qarşı qoruması hamı tərəfindən qəbul olunmuş bir məsələdir. On iki imam şiələrində isə Əbu Talibin məqamı daha üstündür, çünki onlar Əbu Talibin iman əhli olduğuna etiqad edirlər. əş-Şeyx əl-Mufid yazır ki, "Əbu Talibin - Allah ondan razı olsun! - imanına dəlalət edən şeylərdən biri də onun Allahın elçisinə - salləllahu aleyhi va əlihi - olan sevgisinin saflığı, ona qəlbi, əli və dili ilə dəstək olması, iki oğlu Əli və Cəfərə ona tabe olmağı əmr etməsidir…" və əlavə edir: "Üstəlik müstəfid[360] olaraq bizə gəlib çatmış xəbərdə Cibril - aleyhissələm - Əbu Talib vəfat etdikdə Allahın elçisinin - salləllahu aleyhi va əlihi - yanına gəldi və dedi: "Ey Muhəmməd! Rəbbin sənə salam göndərir və sənə deyir: "Məkkədən çıx, çünki sənin dəstəkçin (nasir) öldü."[361] əl-Mufidə görə müstəfid dərəcəsinə çatmış bu xəbərdə Allah Əbu Talibi peyğəmbərin "nasiri", yəni köməkçisi, dəstəkçisi adlandırır. Yusuf əl-Bəhrani daha da irəli gedir və Əbu Talib olmasaydı İslam dininin olmayacağını iddia edir. O yazır: "Hər ağıl sahibi üçün aşkardır ki, Əbu Talib belə misli görülməmiş bir müvəffəqiyyətə yalnız və yalnız iman əhli olduqdan sonra müvəffəq olmuşdur. Çünki bütün dinlər içində üstünlüyü və şərəfi ilə seçilən və Qiyamətə qədər davam edəcək bu din yalnız onun sayəsində mümkün oldu, əgər olmasaydı bu dinin ayaqda durması mümkün olmazdı. Peyğəmbərlərin ən şərəflisi olan bu peyğəmbərin sözü yalnız onun sayəsində tamamlandı və dəvəti də yalnız onun sayəsində davam edə bildi…"[362] Əbu Talibin mömin olması məsələsi şiə məzhəbində o qədər önəmli bir məsələdir ki, bunun üçün imamlardan çox sərt hökmlər nəql ediblər. Belə bir rəvayətlərdən birində "Abdulazim bin Abdilləh əl-Ələvi xəstə ikən Əbul-Həsən ər-Rida'ya - aleyhissələm - məktub yazır: "Ey

---

[359] "Musnəd Əhməd", 6/382 (3832); İbn Məcə (150); Şueyb Arnavut isnadının həsən olduğunu yazır.

[360] Mustəfid hədis mütəvatir həddinə çatmamış, lakin hər təbəqədə üçdən - bəzilərinə görə ikidən - çox ravinin rəvayət etdiyi hədisə deyilir. Bax: əş-Şəhid əs-Səni, "ər-Riayə fi İlm əd-Dirayə", səh: 69;

[361] əl-Mufid, "əl-Fusul əl-Muxtəra", səh: 282-283;

[362] əl-Bəhrani, "Sələsil əl-Hədid fi Təqyid İbn Əbil-Hədid", 2/88;

peyğəmbər övladı! Əbu Talibin cəhənnəmin dayaz bir yerində olması, bundan beyninin qaynaması ilə bağlı rəvayət olunmuş xəbər haqqında məni məlumatlandır." ər-Rida - aleyhissələm - ona cavab yazdı: "Bismilləhirrahmənirrahim; əmmə bəd: Şübhəsiz ki, sən əgər Əbu Talibin imanında şəkk etsən sənin gedəcəyin yer cəhənnəm olacaq." Bu rəvayəti qeyd etdikdən sonra əl-Məclisi daha bir rəvayətə yer verir: "Əbu Abdilləh - aleyhissələm - dedi: "Ey Yunus, insanlar Əbu Talib haqqında nə deyirlər?" Dedim: "Canım sənə fəda olsun! Deyirlər ki, o, atəşin dayaz bir yerindədir, ayaqlarında atəşdən ayaqqabilar var və beyni buna görə qaynayır." Dedi: "Allahın düşmənləri yalan danışırlar. Əbu Talib peyğəmbərlərin, sıddıqların, salehlərin dostlarındandır və bunların dostluğu necə də gözəldir!"[363] Həmçinin Şeyx əs-Saduq imami şiələrinin etiqadı haqqında yazdığı kitabında deyir: "Peyğəmbərin ataları haqqında etiqadımız budur ki, Adəmdən Abdullaha qədər onların hamısı müsəlmanlar olublar və (həmçinin etiqad edirik ki,) Əbu Talib müsəlman idi, anası Əminə bint Vəhb də müsəlman olub."[364] Əbu Talibin müsəlman olmasında şiələrin icma etdiyi qeyd edilir, hətta onun peyğəmbərimizə peyğəmbərlik verilmədən əvvəl mömin olduğunu deyirlər. əl-Kafi kitabında keçən bir rəvayətdə Əbu Talibin arvadı Fatimə bint Əsəd peyğəmbərimizi uşaq ikən götürür və hər tərəfi işıqlandıran bir nur görür. Bundan təəccübləndiyini görən Əbu Talib ona deyir: "Sən elə bir uşaq dünyaya gətirəcəksən ki, bu uşağın vasisi olacaq." əl-Məclisi bu hədislə bağlı izah verərkən yazır: "Bu iki xəbər ona dəlalət edir ki, Əbu Talib hələ (Muhəmmədə) peyğəmbərlik verilmədən əvvəl mömin idi və onun müsəlman olması üzərində şiələr icma ediblər. Həm sünnilər, həm də şiələrin kanalları ilə rəvayət olunmuş buna dəlalət edən xəbərlər mütəvatir həddinə çatıb…"[365] Peyğəmbərdən əvvəl Əbu Talibin necə mömin ola biləcəyini soruşsanız bunun da cavabını xəbərlərdə tapmaq mümkündür. Əliyə - kərraməllahu vachəhu - nisbət olunan rəvayətlərdən birində ondan soruşurlar: "Peyğəmbərdən - salləllahu aleyhi va əlihi va səlləm - əvvəl vasilərin sonuncusu kim idi?" Dedi: "Atam."[366] Cəfər əs-Sadiq'in belə dediyini iddia edirlər: "Şübhəsiz ki, Abdulmuttalib bir hüccət idi, Əbu Talib onun vasisi idi."[367] Ona görə

---

[363] əl-Məclisi, "Bihər əl-Ənvar", 35/111;

[364] əs-Saduq, "əl-İtiqadət fi Din əl-İməmiyyə", səh: 110;

[365] əl-Məclisi, "Mirətul-Uqul", 26/365;

[366] əl-Əmini, "əl-Ğadir", 7/389;

[367] əl-Amili, "əd-Durr ən-Nəzim", səh: 798;

də əl-Məclisi tərəddüd etmədən yazır ki, "Əbu Talib, İbrahim və İsmayıl peyğəmbərin - aleyhimə əssələm - vasilərindən biri idi və İsrail oğulları kanalından yox, vasilərin kanalından onların kitablarını, vəsiyyətlərini hifz etmişdi…"[368] Bəziləri daha da irəli gedir və Əbu Talib'in də Allah tərəfindən göndərilmiş bir peyğəmbər olduğunu deyirlər.[369] Bunda o qədər də qəribə bir hal yoxdur, çünki vasi məqamı ilə peyğəmbər məqamı arasındakı fərq - bir çox şiə aliminin təsdiqlədiyi kimi - sadəcə addadır; sadəcə olaraq şəriət bu ikisi arasında fərq qoyduğu üçün şiələr bu iki məqamı ayırırlar, yoxsa əqlən bu ikisi arasında elə də əhəmiyyətli bir fərq yoxdur. Bütün bunları qeyd etdikdən sonra qarşımızda israrla duran suala cavab vermək lazımdır. Nə üçün Əbu Talib həmin məclisdə peyğəmbərin - aleyhissalətu vassələm - tələbinə cavab vermədi? Halbuki praktikada hamının etirafı ilə Əbu Talib peyğəmbərin - aleyhissələm - dəvətinə böyük bir dəstək olmuşdu və heç zaman qardaşı oğlunu Qureyşin çirkin planlarına təslim etməmişdi. O zaman Əbu Talibin iman əhli olması, hətta İslamın ayaq üstə durmasının onun sayəsi ilə mümkün olması Dar hədisi ilə nə qədər uzlaşdırıla bilər?! Hətta hədisin variantlarından birində məclisdə oturanlar arasında Əbu Ləhəb'ə qarşı durub onu susduran Əbu Talib olmuşdu. Bu rəvayətdə o, qardaşı Əbu Ləhəbə qəzəblənərək deyir: "Ay Avar![370] Allaha and olsun ki, ona dəstək verəcəyik, sonra yanında olub kömək edəcəyik!" Sonra peyğəmbərə dedi: "Ey qardaşım oğlu! Əgər Rəbbinə doğru dəvət etmək istəsən bizə xəbər et ki, səninlə birlikdə silahlarımızla çıxaq."[371] Bütün bunlardan sonra nə üçün Dar hədisində Əbu Talib digər Muttalib oğulları yanında gülünc obyekti oldu və hələ də həddi-büluğa çatmamış oğluna itaət etməklə vəzifələndirildi?! Heç bir ağıl sahibi şübhə etməz ki, dəvətin ilk başlanğıcında İslama göstərilən dəstəkdə Əli bin Əbi Talib - kərraməllahu vachəhu - atası Əbu Talib ilə müqayisə oluna bilməz. Bəli, Əlinin - radiyallahu anhu - rolu dolğunluq yaşına çatdıqda, Məkkə dönəminin sonunda və Mədinədə özünü

---

[368] əl-Məclisi, "Bihər əl-Ənvar", 17/142;

[369] Bunu iddia edən şiə alimləri çox deyil. Onların arasında Şeyx Muzəmmil Hüseyn əl-Meysəmi və Ayətullah Muhəmməd Cəmil Həmmud əl-Amili göstərilə bilər.

[370] əl-Yaqubi'nin tarixində bu yerdə "övrət" sözü keçir, lakin kitablarda məşhur olan budur ki, "təkgöz" mənasına gələn "avar" sözü deyilib. Əbu Ləhəbin gözündə bir eyib yox idi, lakin burada fərqli izahlar verilib. Dil alimi İbnul-Arabi'yə görə ərəblər eyni ata və anadan qardaşı olmayana "avar" deyiblər. İbn Digərləri isə deyir ki, bu söz, sadəcə olaraq əxlaqı, xarakteri pis və keyfiyyətsiz olanlar üçün işlədilir. Bax: əl-Mursi, "əl-Muhkəm val-Muhit əl-Azam", 2/343; əz-Zəməxşəri, "əl-Fəiq fi Ğarib əl-Hədis", 3/37;

[371] "Tarix əl-Yaqubi", 2/27-28;

göstərdi, amma İslam dəvətinin hələ təzə başladığı dönəmdə Dar məclisində iştirak edənlərdən heç biri İslam dini və peyğəmbəri üçün Əbu Talib'in etdiyinin eynisini edə bilməmişdi. Bütün bunlara baxmayaraq necə olur ki, peyğəmbərinköməkçisi məqamı ona yox, həddi-büluğa çatmamış uşağa verilir?! Bütün bunlar ona dəlalət edir ki, dar hədisində bizə təqdim olunan məzmun və məna doğru deyildir, lakin müəyyən məqsədlərə xidmət etmək üçün uydurulmuş mətnlərdir.

İbn Mutahhir əl-Hilli'yə bu dəlillə bağlı cavab verən Şeyxul-İslam İbn Teymiyyə toxunduğu nöqtələr arasında altıncı və yeddinci yerdə bunları yazır: "Altıncı: Onun məclisdəkilərə - "kim bu işdə mənə cavab verərsə, bunu həyata keçirməkdə mənə kömək olarsa mənim qardaşım, vəzirim, vasim və məndən sonra xəlifəm olacaq" - şəklində dediyi sözlər peyğəmbərə - salləllahu aleyhi va səlləm - nisbət edilmiş iftiradır, bunu ona nisbət etmək caiz deyildir. Çünki şəhadət sözlərini təsdiqləmək və bu işdə kömək etmək tələbinə cavab vermək bütün bunları gərəkdirməz, çünki bütün möminlər bu iki şəhadət kəliməsinə cavab veriblər və bu işdə ona kömək göstəriblər; bu dinin ayaqda durması üçün, ona itaət etmək uğrunda canlarını və mallarını qurban ediblər, öz vətənlərini tərk ediblər, öz qardaşlarına düşmən olublar, ülfətdən sonra ayrılığa, izzətdən sonra zillətə, varlıqdan sonra fəqirliyə, rahatlıqdan sonra əziyyətə səbr etməli olublar. Onların bununla bağlı həyat hekayələri məşhurdur. Bütün bunlara baxmayaraq onlardan heç biri bu səbəblə peyğəmbərin xəlifəsi olmadı… Yeddinci: Həmzə, Cəfər və Ubeydə bin əl-Həris də Əli kimi iki şəhadət kəliməsinə və bu işdə kömək olmaq çağırışına cavab vermişdilər, beləki onlar da ilk əvvəldən Allaha və rasuluna iman etmiş ilk müsəlmanlardan idilər. Hətta Həmzə möminlərin sayı qırx olmadan əvvəl iman etmişdi…"[372] Bu arqument qarşısında şiə alimi Cəfər əl-Murtəda əl-Amili yazır ki, "Həmzənin (o məclisdə) mövcud olması yalnız "inzər" ayəti nazil olmadan əvvəl iman etmiş olduğu təqdirdə problem olardı. Biz bunu dəqiq bilmək bir tərəfdə qalsın, heç bunu ehtimal da edə bilmirik, çünki görünən budur ki, Həmzənin müsəlman olması İslam dəvəti aşkarda başladıldıqdan sonra olmuşdur…"[373] O zaman Cəfər əl-Murtəda'dan soruşmaq lazımdır ki, Həmzə problemini onun müsəlman olmaq anını gecikdirməklə həll edə bildinizsə Əbu Talibin problemini necə həll edəcəksiz? İbn Teymiyyə'nin yalnız Həmzə, Cəfər və Ubeydə'nin adlarını sayması və Əbu Talibi qeyd etməməsinin yeganə səbəbi budur ki, sünnət əhlindəki

---

[372] İbn Teymiyyə, "Minhəc əs-Sunnə ən-Nəbəviyyə", 7/306-307;

[373] əl-Murtəda, "əs-Sahih min Siratin-Nəbi əl-Azam", 3/68;

məşhur rəyə görə Əbu Talib heç zaman iman etməmişdi. Lakin şiələrdə iddia olunan icmaya görə Əbu Talib iman etmişdi, hətta peyğəmbərə peyğəmbərlik vəzifəsi verilmədən əvvəl mömin idi. Cəfər əl-Murtəda bu problemi həll etmək üçün deyir ki, Həmzə də, Əbu Talib də yaşlı idilər və ona görə də peyğəmbərin - aleyhissələm - etdiyi bu çağırışda onları qəsd etmədiyinə inanırdılar, çünki Əbu Talib "çox yaşlı bir qoca idi, peyğəmbərin - salləllahu aleyhi va əlihi - vəfatından sonra sağ qalacağı gözlənilmirdi, ona görə də nə onun, nə də Həmzənin özlərini peyğəmbərdən sonra xəlifə olmaq üçün irəli sürməklərinin bir mənası yox idi, ən azından onlar özləri o zaman bu cür fikirləşirdilər."[374] Görəsən Cəfər əl-Murtəda o məclisdə peyğəmbərin əmilərinin nə fikirləşdiklərini bilmək üçün hansı vasitələrdən, hansı biliklərdən bəhrələnib? Belə bir cavabın gülünc tərəfi odur ki, orada iştirak edən Abdulmuttalib oğullarının, yəni peyğəmbərin əmilərinin hamısı peyğəmbərdən - aleyhissalətu vassələm - yaşca böyük idilər. Hətta Cəfər əl-Murtəda yazır ki, peyğəmbərimizin atası Abdullah Abdulmuttalib oğulları içində yaşca ən kiçikləri idi və buradan belə nəticə çıxarır ki, həm Həmzə, həm də Abbas peyğəmbərdən ən az iyirmi il böyük idilər.[375] Bu cavabdan belə anlaşılır ki, peyğəmbər - aleyhissələm - Abdulmuttalib oğullarını evinə dəvət edib onlara imamlıq məqamını təklif edərkən əslində onlar peyğəmbərdən - aleyhissalətu vassələm - çox yaşlı olduqları üçün buna razı olmadılar, çünki onların peyğəmbərdən uzun həyat yaşayacaqları ehtimal olunmurdu. Cəfər əl-Murtəda'nın verdiyi cavab peyğəmbəri hikmətsiz olaraq göstərir, çünki Cəfər əl-Murtəda özü fikirləşib Əbu Talibin, Həmzənin nə üçün imamlıq təklifi ilə razılaşmadıqlarını dərk edə bilirsə o zaman görəsən peyğəmbərimizin bunu dərk etməməyinin səbəbi nə idi?! Halbuki rəvayətə görə peyğəmbərimiz - aleyhissələm - həmin məclisdə Abdulmuttalib oğullarına bunu demişdi: "Ey Abdulmuttalib oğulları! İslamda başlar olun, quyruqlar olmayın!"[376] Şiələrin kitablarına inanmalı olsaq Əbu Talib artıq İslamda bir baş idi, bir lider idi. Onun arxasınca Həmzə və Abbas da eyni şəkildə İslamda böyüklər oldular. Görəsən Əbu Ləhəb'in həmin məclisdə istehza etməsinin səbəbi peyğəmbərin çox yaşlı əmilərinə özündən sonra xəlifə olmaq təklifinə görə idimi?! Biz inanırıq ki, bu rəvayəti uyduran kimsələr düşünmədən

---

[374] Eyni mənbə, 3/69;

[375] Doğru olan budur ki, Həmzə və Abbas peyğəmbərimizdən - aleyhissalətu vassələm - təxminən 2-4 il böyük idilər. Bax: İbn Həcər, "əl-İsabə", 2/105 və 3/511. İbn Sad, "ət-Tabəqat əl-Kubra", 4/ 5, Xanəci; əl-Bələzuri, "Ənsəbul-Əşraf", 4/1;

[376] İbn Asəkir, "Tərix Dəməşq", 42/50;

bütün bu absurd nəticələri gözardı ediblər, lakin həqiqətən də bu xəbərlərdəki fəsad düşünən insanlar üçün aşkardır.

Bu rəvayətlərin ən şikəst və ən qəribə tərəflərindən biri də imamət məqamının özü ilə bağlıdır. Dar hədisinin səhih olduğunu qəbul etmək bizi belə bir nəticə ilə üzləşdirir: Əli bin Əbi Talib'in - kərraməllahu vachəhu - imamlığını qəbul etmək İslamın əvvəlində artıq fərz buyurulmuşdu. Çünki peyğəmbər - aleyhissələm - şiələrin iddiasına görə Abdulmuttalib oğullarına Əlinin sözünə qulaq asıb itaət etməyi əmr etmişdi. Əgər Abdulmuttalib oğulları üzərində belə bir hökm var idisə bu, bütün ümmətin üzərinə də fərz olmalı idi, çünki bu hədislə iddia olunan "imamət məqamı" şiələrin üsulud-dindən hesab etdikləri rükunlardan biridir və belə bir etiqadi əsasın ümmətdən yalnız Abdulmuttalib oğullarına fərz olub, digərlərinin üzərindən düşməsi mümkün deyildir. Kitabımızın əvvəlində təqdim etdiyimiz kimi imami şiələrinə görə imamət dinin ərkanlarındandır, imanın səhih olması üçün Əlinin və digər imamların imamlığına iman etmək şərtdir və tövhidə inanmaq, peyğəmbəri təsdiq etmək kifayət etmir. Bu o deməkdir ki, hələ dəvətin əvvəlindən iman etmiş müsəlmanlardan hər kim Əlinin imamətinə iman etməmişdilərsə tövhidə və risalətə iman etmələri kifayət etməməli idi. Belə bir nəticə əl-Kafi kitabında keçən bir xəbərlə ziddiyyət təşkil edir, beləki İmam Muhəmməd əl-Baqir'ə nisbət edilən bir xəbərdə o, deyir: "Sonra Allah Muhəmmədi - salləllahu aleyhi va əlihi - göndərdi və o, Məkkədə on il qaldı; bu on il ərzində Məkkədə "lə iləhə illəllah va Muhəmməd rasulullah" demiş hər kim öldüsə Allah onu bu təsdiqinə görə Cənnətinə daxil edəcək və bu, təsdiq imanıdır…"[377] Bu rəvayətə əsaslanaraq şiə alimi Murtəda əl-Ənsari yazır: "Aşkar olan budur ki, cəhənnəmdə əbədi qalmağı gərəkdirən küfr həddindən insanı qurtaran imanın həqiqəti şəriət yayıldıqdan sonra da dəyişməyib."[378] Bu sözlərin tələb etdiyi məna budur ki, bir kimsə vilayəti təsdiqləməzsə, yalnız tövhid və risalə ilə kifayətlənərsə o, mömin sayılır. Ən azından əl-Kafi'də keçən hədisdən anlaşılır ki, Məkkə dönəmində "imamət" məsələsi fərz edilməmişdi. Əgər fərz edilməmişdisə Dar hədisində keçdiyi kimi peyğəmbərin - aleyhissalətu vassələm - Əlini özünün vasisi, xəlifəsi təyin etməsi doğru ola bilməz. Üstəlik Allahın elçisi - aleyhissalətu vassələm - qəbilələrdən beyət aldığında onlardan iki şəhadət kəliməsini tələb edərdi və şəhadətdə üçüncü bir hissə, daha dəqiq desək Əlinin vilayəti yox idi.

---

[377] əl-Kuleyni, "əl-Kafi", 2/29;

[378] əl-Ənsari, "Fəraidul-Usul", 1/561;

Əksinə şiələrin özlərinin xəbər verdiklərinə əsasən peyğəmbər - aleyhissalətu vassələm - Kiləb oğulları qəbiləsinə İslamı ərz etdiyində dedilər: “Yalnız o şərtlə sənə beyət edə bilərik ki, bu iş səndən sonra bizə aid olsun!” (Peyğəmbər) dedi: “Bu iş Allaha aiddir, dilərsə sizə verər, dilərsə başqasına verər.” Buna görə də onlar beyət etmədilər və dedilər: “Sənin döyüşlərin üçün qılınc vurmağımızı, sonra bizim üzərimizə başqasını hakim qılmanı istəmirik.”[379] Peyğəmbərin - aleyhissələm - yanına gələrək ona beyət etmiş və ya beyətdən imtina etmiş qəbilələr haqqında gələn rəvayətlərdə maraqlı məlumatlarla qarşılaşırıq. Hicrətin onuncu ilində Bənu Amir qəbiləsi bir heyət ilə Allahın elçisinə - aleyhissələm - gəldiklərində heyətdə yer alan Amir bin Tufeyl dedi: “Ey Muhəmməd, müsəlman olsam mənə nə verəcəksən?” Dedi: “Müsəlmanların xeyrinə olan hər şey sənin də xeyrinə, aleyhinə olan hər şey sənin də əleyhinə olacaq.” Dedi: “Bu işi özündən sonra mənə vəd edəcəksənmi?” Dedi: “Bu iş nə sənə, nə də qövmünə aiddir.”[380] Bir başqa rəvayətdə isə deyir: “Bu mənə aid deyildir, bu yalnız Allaha aiddir və O, istədiyi kəsə bunu verəcək.”[381] Çox maraqlıdır ki, nə üçün Allahın elçisi - aleyhissalətu vassələm - qəbilələrdən beyət alarkən onlardan Əliyə vəliəhd olaraq beyət etməklərini də tələb etmirdi?! Əgər vilayət, imamət məsələsi şiələrin iddia etdikləri kimi nübuvvət qədər əsaslı bir məsələdirsə o zaman Allahın elçisinin İslamı qəbul etmək istəyən insanlardan bununla bağlı heç bir şahidlik tələb etməməsi imkansız olmalıdır. Bununla belə biz oxuduğumuz heç bir mötəbər kitabda belə bir rəvayət ilə, tarixi sübut ilə qarşılaşa bilmirik.

Dar hədisinin zahirində imamət inancı ilə ziddiyyət təşkil edən məsələlərdən biri də imamlıq məqamının seçim və kəsb ilə əldə edilə biləcəyi təəssüratını yaratmasıdır. Daha əvvəl izah etdik ki, imamiyyə məzhəbində belə bir təsəvvür batildir, hətta küfrdür. Maraqlıdır ki, hədislərin heç birində Allahın elçisi - salləllahu aleyhi va səlləm - onun evində qonaq olmuş şəxslərə bu məsələni izah etmir; onlara bu məqamı təklif etdikdən sonra bu məqamın əslində onlar istəsəydi belə onlar üçün mümkün olmayacağını bəyan etmir, halbuki təklifin özündən belə bir seçim haqqının olması təsəvvürü formalaşır. Əgər bu təsəvvür xətadırsa bu xətanı ifşa etmək, doğru olanı bəyan etmək Peyğəmbərə

---

[379] əl-Məclisi, “Bihər əl-Ənvar”, 23/74-75;

[380] İbn Sad, “ət-Tabəqat əl-Kubra”, 1/310, Dar Sadir

[381] “Təfsir əs-Sələbi”, 5/276; əl-Vahidi, “Əsbəbun-Nuzul”, səh: 278;

- aleyhissalətu vassələm - verilmiş bir vəzifədir. Qəbul olunmuş qaydaya görə "bəyanı ehtiyac vaxtından sonra saxlamaq icazəli deyildir."

Sonunda əlavə edək ki, dar hədisi şiələrdəki digər hədislərlə də ziddiyyət təşkil edir. əl-Kuleyni "əl-Kafi" kitabında deyir ki, İmam Cəfər əs-Sadiq deyib: "Peyğəmbər – sallallahu aleyhi və alih – vəfat edəcəyi zaman Abbas ibn Abdulmuttalibi və möminlərin əmirini – əleyhissəlam – çağırdı. Abbasın üzünə baxaraq buyurdu: "Ey Muhəmmədin əmisi! Muhəmmədin mirasını götürüb onun borclarını ödəyib vəsiyyətlərini yerinə yetirərsənmi?" Abbas cavab verdi: "Ey Allahın Rəsulu! Atam-anam sənə fəda olsun! Mən çox uşaqlı və az imkanlı bir qocayam. Sən isə küləklə yarışırdın – (yəni sənə çatmaq, məsuliyyətini daşımaq çətindir)." Peyğəmbər – sallallahu aleyhi və alih – bir an başını aşağı saldı və sonra yenə buyurdu: "Ey Abbas! Muhəmmədin mirasını götürüb onun borclarını və vəsiyyətlərini yerinə yetirərsənmi?" Abbas təkrar dedi: "Atam-anam sənə fəda olsun! Mən çox uşaqlı və az imkanlı bir qocayam. Sən isə küləklə yarışırdın." Peyğəmbər buyurdu: "Həqiqətən, onu yalnız haqqıyla daşıyacaq birinə verəcəyəm." Sonra (üzünü Əliyə çevirərək) buyurdu: "Ey Əli! Ey Muhəmmədin qardaşı! Muhəmmədin borcunu ödəyib vəsiyyətlərini yerinə yetirər və mirasını qəbul edərsənmi?" Dedi: "Bəli, atam-anam sənə fəda olsun! Bu məsuliyyət mənim boynumdadır." Peyğəmbər – sallallahu aleyhi və alih – onun bu sözünə görə sevindi və barmağından üzüyünü çıxarıb dedi: "Bu üzüyü mən sağ ikən tax." (Əli) dedi: "Mən onun barmağımdan çıxardığı üzüyə baxdım və onu barmağıma taxanda düşündüm ki, Peyğəmbərin qoyub getdiklərinin içində ən çox bu üzüyü istəyərdim." Sonra (Peyğəmbər) nida edib dedi: "Ey Bilal! Mənə dəbilqəmi, zirehimi, bayrağımı, köynəyimi, Zülfüqar qılıncını, Səhabı (libasını), Əbriqəni və əsanı gətir!..."[382] Qəribə deyilmi ki, İslam dəvətinin əvvəlində Dar hədisində bu mirasın Əliyə aid olduğunu təsdiqlədikdən sonra, hətta Təbukda və sonra Ğadir-Xumda bunun Əliyə olduğunu bəyan etdikdən sonra Peyğəmbər - aleyhissalətu vassələm - ölüm yatağında ikən bunu bir daha əmisi Abbasa təklif edir?! əş-Şərif ər-Radi'nin rəvayət etdiyi bir başqa rəvayətdə isə İmam əl-Həsən deyir: "Möminlərin əmiri - aleyhissələm - mənə rəvayət etdi; dedi: "Allahın Rəsulu– sallallahu aleyhi və alih – ölüm yatağında ikən məni çağırdı və insanları da çağırdı. Sonra buyurdu: "Kim mənim borcumu və vədimə bağlı olan haqqımı (yəni verdiyim vədləri) ödəyəcək və məndən sonra mənim əhli-

---

[382] əl-Kuleyni, "əl-Kafi", 1/236; İbn Şəhri Əşub "Mənaqib Al Əbi Talib" kitabında (2/248) bu hədisin üzərində icma olduğunu yazır.

beytimdə və ümmətimdə xəlifəm olacaq?" Camaat (bu məsuliyyəti üzərinə götürməkdən) çəkindi. Mən isə irəli çıxdım və bu işi boynuma götürdüm. Bundan sonra dəvəsi olan əl-Adbə'ni, atı Murtəciz'i, qatırını, uzunqulağını, qılıncı Zülfüqarı, "Zatul-Fudul" adlı zirehini və onun müharibədə ehtiyac duyduğu hər şeyi mənə vermək üçün göstəriş verdi. Sonra müharibədə qarın nahiyəsinə bağladığı qurşağı (kəməri) axtardı və onu tapa bilmədi. Onlara onu axtarmağı tapşırdı. Daha sonra bütün bunları mənə təhvil verdi və buyurdu: "Ya Əli, bunların hamısını mən sağ ikən qəbul et ki, məndən sonra heç kim bu işdə sənə qarşı çıxmasın." Sonra mənə bu əşyaları öz evimə aparmağı əmr etdi və mən də onları evimə köçürdüm."[383] Aşkar olan budur ki, Əlinin - kərraməllahu vachəhu - imamlığını isbat etmək istəyən şiələr bu rəvayətləri bir-birilərindən xəbərsiz şəkildə uydurublar və arada koordinasiya olmayıb, buna görə də bu cür aşkar ziddiyyətlərlə qarşılaşırıq. Hətta görünür ki, bu rəvayətləri uyduran şiələr imamlğın ilahi təyinat olduğuna inanmayıblar, lakin Peyğəmbərin - aleyhissalətu vassələm - seçimi ilə baş verə biləcəyinə etiqad ediblər, əks təqdirdə bu cür rəvayətlər nəql etməzdilər.

Əslində Peyğəmbərin - salləllahu aleyhi va səlləm - öz qohumlarını xəbərdar etməsi hadisəsinin əsli və kökü tarixən sabitdir; yəni ən yaxın qohumlarını qorxudub xəbərdar etmək əmri nazil olduqda Allahın elçisi - salləllahu aleyhi va səlləm - qureyşliləri aşkar şəkildə qorxudub xəbərdar etdi. Bu hadisə bizə səhih və etibarlı sənədlərlə çatıb. İmam Əhməd deyir: "Abdullah bin Numeyr bizə əl-Aməş'dən, o Amr bin Murra'dan, o da Said bin Cubeyr'dən, o isə İbn Abbas'dan belə dediyini rəvayət edir: Allah-Təala : "ən yaxın qohumlarını qorxudub xəbərdar et!" ayəsini nazil etdikdə Peyğəmbər - sallallahu aleyhi və alih - Səfa təpəsinə qalxdı və uca səslə səsləndi: "Ya sabahah!" (Bu ifadə qəfil hücum və ya təhlükəyə qarşı xəbərdarlıq anlamı daşıyırdı). Bunun üzərinə insanlar onun ətrafına toplaşdılar: bəziləri şəxsən gəldi, bəziləri isə nümayəndəsini göndərdi. Peyğəmbər - sallallahu aleyhi və səlləm - dedi: "Ey Abdulmuttalib oğulları! Ey Fihr oğulları! Ey filankəsin övladları! Əgər sizə xəbər versəm ki, bu dağın ətəyində atlılar var və sizə hücum etməyə hazırlaşırlar — mənə inanarsınızmı?" Onlar dedilər: "Bəli, inanarıq." Dedi: "O halda bilin ki, mən sizə qarşı şiddətli bir əzabdan öncə xəbərdarlıq edənəm!" Bunun üzərinə Əbu Ləhəb dedi: "Vay olsun sənə bütün günü! Bizi bunun üçünmü çağırdın?!" Bunun

[383] ər-Radi, "Xasaisul-Əimmə", səh: 78;

ardınca Allah-Təala bu ayəni nazil etdi: "Əbu Ləhəbin əlləri qurusun! Qurudu da!"[384] Yenə İmam Əhməd deyir: "Muaviyə bin Amr bizə rəvayət etdi; dedi: Zəidə bizə rəvayət etdi; Abdulməlik bin Umeyr bizə Musa bin Talha'dan, o da Əbu Hureyra'dan belə dediyini rəvayət etdi: "Ən yaxın qohumlarını qorxudub xəbərdar et!" ayəsi nazil olduqda, Allahın elçisi – sallallahu aleyhi və səlləm – Qureyşı çağırdı, ümumi və xüsusi olaraq xitab etdi və buyurdu: "Ey Qurayş camaatı! Özünüzü oddan xilas edin! Ey Kəb bin Lueyy övladları! Özünüzü oddan xilas edin! Ey Abdu Mənaf övladları! Özünüzü oddan xilas edin! Ey Haşim övladları! Özünüzü oddan xilas edin! Ey Abdulmuttalib övladları! Özünüzü oddan xilas edin! Ey Fatimə bint Muhəmməd! Özünü oddan xilas et! And olsun Allaha, mən sizin üçün Allah qarşısında heç bir şeyə sahib deyiləm, yalnız sizinlə olan qohumluq bağını qoruyacaq, ona mərhəmət göstərəcəyəm."[385] Bunu həmçinin səhabələrdən Qabisa bin Muxariq və Zuheyr bin Amr'da rəvayət ediblər. Onlar deyirlər ki, "Ən yaxın qohumlarını qorxudub xəbərdar et!" ayəsi nazil olduqda, Allahın elçisi bir dağın başındakı qayalığa gəldi və onun zirvəsinə çıxdı. Sonra nida etdi: 'Ey Abdu Mənaf oğulları! Mən sizi xəbərdar etdim! Mənimlə sizin misalınız, düşməndən qorxub ailəsini qorumağa çalışan bir kişinin misalı kimidir. (O), düşmənin ondan tez davranacağından qorxaraq çığırmağa başladı: *Ya sabahah!*'"[386] Həmçinin Aişə əs-Siddiqa rəvayət edir ki, bu ayə nazil olduqda "Allahın elçisi – salləllahu aleyhi və səlləm

---

[384] "Musnəd Əhməd", 5/17 (2801); "Sahih əl-Buxari", 4492. əl-Buxari bunu Ömər bin Həfs bin Ğyas vasitəsi ilə atası Həfs bin Ğiyas'dan, o da əl-Aməş'dən rəvayət edir. Bunu İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında (1/169; əl-Xanəci) şeyxi əl-Vaqidi vasitəsi ilə İbrahim bin İsmail bin Əbi Həbibə'dən, o isə David bin əl-Huseyn'dən, o isə İkrimə'dən, o da İbn Abbas'dan rəvayət edir.

[385] "Musnəd Əhməd", 14/341-342; "Sahih Muslim", 348; Muslim bunu belə rəvayət edir: "Quteybə bin Said və Zuheyr bin Hərb bizə rəvayət etdilər; dedilər: Cərir bizə Abdulməlik bin Umeyr'dən rəvayət etdi…" Bunu həmçinin İshaq bin Rahaveyh "əl-Musnəd" kitabında (224) şeyxi Cərir'dən eyni isnadla rəvayət edir. əd-Dərimi "əs-Sunən" kitabında (3/1796; rəq: 2774) isə deyir: "əl-Həkəm bin Nafi bizə Şueyb'dən, o da əz-Zuhri'dən belə dediyini rəvayət etdi; Said bin əl-Museyyəb və Əbu Sələmə bin Abdirrahmən mənə xəbər verdilər ki, Əbu Hureyra dedi…" Daha sonra hədisi zikr edir. Bu isnadın eynisini İmam əl-Buxari "əs-Sahih" kitabında (2602) Əbul-Yəmən - Şueyb - əz-Zuhri - Said bin əl-Museyyəb və Əbu Sələmə - Əbu Hureyra vasitəsi ilə rəvayət edir. İmam Muslim isə "əs-Sahih" kitabında (351) bunu Hərmələ bin Yəhya - İbn Vəhb - Yunus - İbn Şihəb əz-Zuhri - İbnul-Museyyəb və Əbu Sələmə - Əbu Hureyra kanalı ilə rəvayət edir.

[386] "Musnəd Əhməd", 25/255 və 34/210; İbn Əbi Şeybə, "əl-Musnəd", (885); "Sahih Muslim", (353); Bunu Qabisa bin əl-Muxariq və Zuheyr bin Amr'dan rəvayət edən Əbu Osman ən-Nəhdi'dir, ondan isə Süleyman ət-Teymi rəvayət edir. Ondan isə İbn Zurey, Muhəmməd bin Əbi Adiy, İsmail bin Uleyyə, Yəhya bin Said əl-Qattan və başqaları rəvayət edirlər.

– buyurdu: "Ey Fatimə binti Mühəmməd! Ey Safiyyə binti Abdulmuttəlib! Ey Abdulmuttəlib oğulları! Mən sizi Allahdan qoruyacaq bir şeyə malik deyiləm! Mənim malımdan nə istəyirsinizsə, istəyin."[387] Həmçinin Əbu Musa əl-Əşari deyir ki, ""Ən yaxın qohumlarını qorxudub xəbərdar et!" ayəsi nazil olduqda Allahın elçisi - salləllahu aleyhi va səlləm - barmaqlarını qulaqlarına qoydu və səsini qaldıraraq çağırdı: "Ey Abdu Mənaf oğulları! Ya Sabahah!"[388] "Ya Sabahah!" ləfzi isə ərəblərdə ya düşmənə qarşı hücuma hazırlaşarkən, ya da müdafiəyə səfərbər etmək istənildikdə işlənilən ifadədir. Səhabələrdən səhih və sağlam sənədlərlə gəlmiş bu rəvayətlər göstərir ki, ayə nazil olduqda Allahın elçisi - salləllahu aleyhi va səlləm - ümumilikdə qureyşliləri, xüsusilikdə isə ən yaxın qohumlarını ictimai şəkildə xəbərdar edib.

Bu rəvayətlərin və ondan əvvəl təqdim etdiyimiz məlumatların işığında deyə bilərik ki, Darh hədisi isnad baxımından sabit olmayıb, əksinə belə bir hadisənin baş vermədiyinə dair güclü əsaslar ortadadır. Mətninə gəldikdə isə onun da problemli olduğunu bacardığımız qədər izah etdik; mən əslən imamiyyə məzhəbinin fundamental prinsipləri ilə ziddiyyət təşkil edir, şiə alimlərinin təklif etdikləri izahlar isə bu ziddiyyətləri çözməkdə acizdir.

## Mənzilə hədisi

Hədis dəlilləri içində növbəti yeri şübhəsiz ki, mənzilə hədisinə verməliyik. Bu hədis şiələrin Əlinin xilafəti ilə bağlı gətirdikləri iki ən məşhur hədisdən ikincisidir. İmam Muslim və əl-

---

[387] İbn Rahaveyh "əl-Musnəd" kitabında (753) deyir: "Əbu Muaviyə (Muhəmməd bin Xazim əd-Darir - siqa) bizə xəbər verdi; Hişəm bin Urva bizə atası (Urva bin əz-Zubeyr)dən, o da (xalası) Aişə'dən belə dediyini xəbər verdi…" Sonra hədisi rəvayət edir. ən-Nəsai "əs-Sunən əl-Kubra" kitabında (10/207; ər-Risalə) şeyxi İshaq bin Rahaveyh vasitəsi ilə eyni isnadla rəvayət edir. Bunu İmam Əhməd "əl-Musnəd" kitabında (41/494; ər-Risalə) şeyxi Vaki vasitəsi ilə Hişam bin Urva'dan, o isə atasından, o da Aişədən rəvayət edir. İmam Muslim də "əs-Sahih" kitabında (350) bu hədisi Muhəmməd bin Abdilləh bin Numeyr - Vaki və Yunus bin Bukeyr - Hişəm bin Urva - Urva bin əz-Zubeyr - Aişə kanalı ilə rəvayət edir.

[388] "Sunən ət-Tirmizi", 3463; ər-Risalə çapında Şeyx Şueyb Arnavutun rəhbərliyi altındakı təhqiq əhli hədisin səhih olduğunu deyirlər.

Buxari'nin "əs-Sahih" kitablarında rəvayət etdikləri hədisdə Sad bin Əbi Vaqqas deyir: "**Rəsulullah Təbuq səfərində Əli ibn Əbu Talibi Mədinədə qoydu.** Bunun üzərinə Əli dedi:"Ya Rəsulallah! Məni qadınlar və uşaqlar arasında buraxırsanmı?" Peyğəmbər ona belə cavab verdi: "Sən razı deyilsənmi ki, mənim üçün Harunun Musa üçün olan məqamında olasan? Lakin məndən sonra peyğəmbər yoxdur."[389] Şeyxut-Taifə ət-Tusi deyir: "Onun imamətinə dəlalət edənlərdən biri də Peyğəmbərdən - salləllahu aleyhi və alihi və səlləm - nəql olunan bu hədisdir: "Sən mənim üçün Harunun Musa üçün olan məqamında olacaqsan, lakin məndən sonra peyğəmbər yoxdur." Bu sözlə Peyğəmbər - salləllahu aleyhi və alihi və səlləm - Harunun Musaya nisbətdə sahib olduğu bütün məqamları ona isbat etdi, yalnız istisna olaraq peyğəmbərlik məqamını çıxmaqla. Biz də bilirik ki, Əli - əleyhissəlam - onun atası və anası bir olan qardaşı deyildi. Bundan əlavə, Harunun Musa üçün olan məqamlarından biri də onun öz qövmü üzərində itaəti vacib olan şəxs olması və Allahın onun vasitəsilə Musanın gücünü artırması idi.Elə isə, bu məqamlar Əli - əleyhissəlam - üçün də sabit olmalıdır. Onun itaətinin vacib olması isə onun imamətinin sübutudur."[390]

Mənzilə hədisinin mənası və dəlaləti haqqında danışmadan əvvəl bəzi ilkin məlumatlara toxunmaq lazımdır. Mənzilə hədisi səhihdir və ümmət bu hədisi səhih hədis olaraq qəbul edib[391] və İbn Abdilbərr'in dediyi kimi "ən sabit və ən səhih əsərlərdəndir."[392] Onun mütəvatir olub olmaması məsələsində isə ixtilaf ediblər. İbn Abdilbərr, əs-Suyuti və əl-Kəttəni[393] kimi alimlər hədisi mütəvatir hesab ediblər. əl-Kəttəni deyir ki, bu hədis "iyirmidən çox səhabədən gəlir, onların hamısını İbn Asəkir iyirmi vərəqədə toplayıb." Alimlərin bir hissəsi isə hədisin səhih olduğunu qəbul etsə də onun mütəvatir dərəcəsinə çatmadığını deyiblər, lakin bunu "müstəfiz" kateqoriyasına aid ediblər. Bunların arasında sünnət əhlindən Saduddin ət-Təftəzəni (h. 791), İbn Həcər əl-

---

[389] "Sahih Muslim", 2404;

[390] ət-Tusi, "əl-İqtisad", səh: 222;

[391] Bildiyimiz qədər ilə Seyfuddin əl-Əmidi (v. h. 631) və ona tabe olmuş Azududdin əl-İci'dən (h. 756) başqa heç kim mənzilə hədisinin səhihliyində şəkk etməyib. Bu iki alim isə kəlam alimləri olaraq tanınıblar, hədis üzrə mütəxəssis olmayıblar.

[392] İbn Abdilbərr, "əl-İstiyəb fi Mərifətil-Əshəb", 3/1097;

[393] İbn Abdilbərr, "əd-Durar fi İxtisar əl-Məğazi vas-Siyər", səh: 239; əs-Suyuti, "Qatful-Əzhər əl-Mutənəsira", səh: 281; əl-Kəttəni, "Nəzmul-Mutənəsir", səh: 233;

Heytəmi (h. 974), Burhənuddin əl-Hələbi (h. 1044) kimi alimlər[394] gəlir. Onların hədisin mütəvatir olmasını qəbul etməməklərinin səbəbi böyük ehtimal ki, rəvayət yollarının xeyli hissəsində yalançı ravilərin olmasına görədir. Sanki bu hədisin əsli dörd və ya beş səhabədən sabit olmuş və daha sonra bəzi kufəli ravilər tərəfindən rəvayət yolları çoxaldılmışdır. Bəzi şiə alimlərinin sözlərindən də anlaşılan budur ki, bu hədisin mütəvatirliyi müzakirəyə açıq məsələdir. İmami şiələrdən isə Şeyx Sərab ət-Tunikəbuni (h. 1124) yazır: “Bunlardan biri də *Mənzilə hədisidir*. Bu xəbər, şiələrin möminlərin əmiri Əlinin - əleyhis-salam - imamətinə dəlil olaraq gətirdiyi hədislərdən biridir. Onun dəlil olmasını inkar edənlər bu hədisin mətninin ifadə etdiyi məna barədə danışmış, lakin isnadı barədə heç bir müzakirə aparmamışlar. Bir çox alimlər bu hədisin mütəvatir olduğunu açıq şəkildə bildirmişlər və zahirdə görünən onları dəstəkləyir. Hətta əgər bu hədisin mütəvatir olduğu qəbul edilməsə belə, onun həqiqətən də Rəsulullahdan -salləllahu aleyhi və alihi və səlləm - gəldiyi açıq-aydın görünür. Bunun sübutu, həm sünni, həm də şiə mənbələrində nəql olunması və imamətini inkar edənlərin onu rədd etməyə çalışmamasıdır. Halbuki, onlar İmam Əlinin - əleyhis-salam - imamətini inkar etməkdə olduqca israrlı idilər və inkar edilə bilən hər şeyi inkar etmək üçün böyük səylər göstərirdilər. Lakin onların heç biri bu hədisin Rəsulullahdan - salləllahu aleyhi və alihi və səlləm - nəql olunmadığını ehtimal və ya fərziyyə olaraq belə ortaya qoymamışdır. Bunu yalnız bəzi inkar edənlər etmişlər ki, onların da dedikləri əhəmiyyətli deyil. Çünki onlar söylədiklərinin məntiqli olub-olmaması ilə maraqlanmırlar. Məsələn, *Təcrid* şərhçisi bu hədisin mütəvatir olmasını inkar etmiş, lakin onun səhih olduğunu inkar etməyə gücü çatmamışdır, çünki hədis son dərəcə fəsahətlidir.”[395] Yaxud da Muhəmməd Said ət-Tabətabəi əl-Hakim yazır: “Peyğəmbərdən - salləllahu aleyhi va əlihi va səlləm - müstəfiz və ya mütəvatir olaraq gəlmişdir ki, o, müxtəlif münasibətlərdə möminlərin əmiri Əlinin - aleyhissələm - ona mərtəbəsinin Harunun Musaya olan mərtəbəsi olduğunu, lakin bir peyğəmbər olmadığını açıq şəkildə bildirmişdir.”[396] Bu sözlərin müxtəlif münasibətlərdə deyilmiş olması şiələr üçün önəmlidir və qarşıda bu barədə söz açacağıq. Lakin burada göstərmək istədiyimiz budur ki, hədisin mütəvatir olub olmaması

---

[394] ət-Təftəzəni, “Şərhul-Məqasid”, 2/291; İbn Həcər, “əs-Savaiq əl-Muhriqa”, 1/73; əl-Hələbi, “əs-Sira əl-Hələbiyyə”, 3/188;

[395] ət-Tunikəbuni, “Səfinətun-Nəcət”, səh: 90-91;

[396] əl-Hakim, “Usul əl-Aqidə”, səh: 266-267;

haqqında ixtilaf olsa da bunun sünnət əhli yanında səhih hədislərdən olmasında heç bir şəkk yoxdur. Ümmətin bu şəkildə bir hədisin səhihliyi üzərində icma etməsi özlüyündə dəlildir ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - bu sözləri Əli haqqında deyib, çünki sünnət əhlinin nəzərində ümmətin icması hüccətdir. Hətta rəvayət yollarının mütəvatirliyində şəkk olsa da ümmətin - sünnisi və şiəsi ilə - icma ilə bu hədisin səhihliyinə şahidlik etməsi onu qətiləşdirir. Bunu gözəl şəkildə izah edən alimlərdən biri olaraq zeydi fəqihlərindən Humeyd bin Əhməd əl-Məhəlli (h. 652) göstərilər bilər, beləki buyurur: "Alimlərimiz - rahiməhumullah - bu hədisin elm (yəni yəqinlik) ifadə etməsində ixtilaf etmişlər. Onlardan bəziləri onun zəruri şəkildə bilinən bir xəbər olduğunu iddia etmiş və onu ilk hədis kimi mütəvatir saymışlar. Digərləri isə bu hədisin səhihliyini qəbul etmiş, lakin onun mütəvatir olduğuna hökm verməmiş, əksinə onun səhihliyini icma yolu ilə təsdiqləmişlər, bu isə hamının onun səhihliyində ittifaq etməsindən sonra olur... Səhihliyində icma edildikdə, Rəsulullahın bunu dediyi qəti olaraq bilinmiş olur, hətta mütəvatir şəkildə nəql olunmasa belə."[397]

Mənzilə hədisinin səhihliyinə toxunduqdan sonra hadisənin məzmununa baxmağımız lazımdır. Peyğəmbərin - salləllahu aleyhi və alihi və səlləm - adəti belə idi ki, döyüşə və ya həccə çıxdıqda, Mədinədə onu əvəz edəcək birini əmir təyin edərdi. Bu, onun Mədinədə olma müddətinin uzun və ya qısa, məsafənin uzaq və ya yaxın olmasından asılı olmayaraq tətbiq etdiyi bir qayda idi. Belə ki, **Uhud döyüşünə** çıxdıqda, Mədinədə öz yerinə **İbn Ümmü Məktumu** qoymuşdu. Halbuki Uhud döyüşü Mədinədən bir mil məsafədə baş vermişdi. **Xəndək döyüşündə** də müşriklərlə vuruşduğu zaman Mədinədə yenə **İbn Ümmü Məktumu** təyin etmişdi. Siyər və məğazi kitablarının müəllifləri Peyğəmbərin - salləllahu aleyhi və alihi və səlləm - öz yerinə təyin etdiyi əmirlərin adlarını diqqətlə qeydə almışlar. Belə ki:

- **Vədan səfərində**: Sə'd ibn Übadə əl-Ənsari əl-Xəzrəci, Xəzrəc qəbiləsinin böyüyü.
- **Buvat səfərində**: Sə'd ibn Muaz əl-Ənsari əl-Əşhəli, Əvs qəbiləsinin böyüyü və ya Səib ibn Osman ibn Məzun.
- **Zü'l-Uşeyrə səfərində**: Əbu Sələmə ibn Abdul-Əsəd əl-Məxzumi, Peyğəmbərin - salləllahu aleyhi və alihi və səlləm - süd qardaşı və iki hicrət sahibi.

---

[397] əl-Muəyyədi, "əl-İsbəh aləl-Misbəh", səh: 126;

- **Bədrin ilk səfərində**: Zeyd ibn Harisə əl-Kəlbi.
- **Bədr döyüşündə**: Əvvəlcə İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri, sonra isə Əbu Lübabə ibn Abdul-Münzir əl-Əmri, hansı ki, Əqəbə gecəsində nübüvvətə ilk beyət edənlərdən biri idi.
- **Səviq döyüşündə**: Əbu Lübabə ibn Əbdül-Münzir əl-Əmri yenidən canişin oldu.
- **Qarqarətül-Küdr səfərində**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Zü-Əmr səfərində**: Osman ibn Affan əl-Qurəşi əl-Üməvi.
- **Bəhran səfərində**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Uhud döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Həmraül-Əsəd döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri
- **Bəni Nəzîr döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri
- **Bədrül-Məv'id döyüşündə**: Abdullah ibn Übey ibn Səlul əl-Ənsari. əl-Xəzrəci və ya Abdullah ibn Ravaha əl-Ənsari əl-Xəzrəci.
- **Zatürruqaa döyüşündə**: Osman ibn Əffan əl-Qurəşi əl-Üməvi.
- **Dumətül-Cəndəl döyüşündə**: Siba ibn Urfuta əl-Ğifari.
- **Mureysi döyüşündə**: Zeyd ibn Harisə əl-Kəlbi.
- **Xəndək döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Bəni Qurəyza döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Bəni Lihyan döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Ğaba döyüşündə**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri.
- **Hudeybiyyə döyüşündə**: Nüməylə ibn Abdullah əl-Leysi əl-Kəlbi.
- **Xeybər döyüşündə**: Siba ibn Urfuta əl-Ğifari.
- **əl-Qadiyyə ümrəsi səfərində**: Əbu Ruhm əl-Ğifari.
- **Məkkənin fəthi, Hüneyn və Taif döyüşlərində**: Əbu Rəhəm Külsum ibn Husayn əl-Ğifari.
- **Həccətül-Vəda zamanı**: İbn Ümmü Məktum əl-Qurəşi əl-Amiri əmir təyin etmişdi.

**Təbuk döyüşü**nə gəldikdə isə Mədinədə kimin canişin təyin edilməsi məsələsində ixtilaf mövcuddur və bu barədə dörd müxtəlif rəvayət var:

**Birinci: Məhəmməd ibn Məsləmə əl-Ənsari əl-Əşhəri** – bu, ən məşhur rəydir və aşağıdakı alimlər tərəfindən qeyd olunub: İbn Hişam, İbn Sə'd, əl-Bəlazuri, İbn Həzm, əd-Dimyati, İbn Səyyid ən-Nas, İbn əl-Qayyim, əs-Səfədi, İbn Kəsir, Bədr əd-Din əl-Hələbi , əl-Qastalani və əs-Salihi.[398]

Onlar, "mənzilə" hədisində gələn ifadə ilə Mədinədə əmir təyin etmə hadisəsini uzlaşdıraraq belə dedilər: Səhih hədislərdə gəldiyi kimi Peyğəmbərin - salləllahu aleyhi va səlləm - Əli ibn Əbi Talibi əmir təyin etməsi onun ailəsinə xas olan bir əmirlik idi, başqa cür desək Peyğəmbərin ailə üzvlərinin təhlükəsizliyini və ehtiyaclarını qarşılamaq məsuliyyəti ona tapşırılmışdı, amma şəhərin üzərindəki ümumi əmirlik isə Muhəmməd bin Məsləmə əl-Ənsari'yə verilmişdi. “Buna dəlalət edən budur ki, münafiqlər onun barəsində şayiə yayaraq dedilər: “Onu özünə yük etmək istəmədiyi üçün geridə buraxdı.”' Bunun üzərinə Əli silahını götürüb Peyğəmbərin yanına gəldi və ona xəbər verdi. Peyğəmbər buyurdu: 'Onlar yalan deyirlər! Lakin səni arxamda qoymağım, mənim arxamda buraxdıqlarıma görədir. Qayıt və mənim yerimə ailəmin və əhlinin yanında qal!'[399]”[400] Bu izahı dəstəkləyən tərəf budur ki, Sad bin Əbi Vaqqas'dan rəvayət olunan hədisdə deyir: “Peyğəmbər Təbuk səfərinə çıxdıqda, Əlini Mədinədə qoydu. İnsanlar onun barəsində danışaraq dedilər: 'O, Əlidən bezdi və onun yol yoldaşlığını xoşlamadı.' Bu söz Əliyə çatdı və o, Peyğəmbərin yanına gəlib ona yetişdi. Sonra dedi: 'Ey Allahın Elçisi! Məni Mədinədə qadınlar və uşaqlarla buraxdın, elə ki, onlar dedilər: "O, Əlidən bezdi və onun yol yoldaşlığını xoşlamadı." Bunun üzərinə Allahın Elçisi buyurdu: 'Ey Əli! Mən səni sadəcə olaraq ailəmin (yanında qalmaq üçün) yerimə buraxdım. Ey Əli! Məgər sən razı deyilsən ki, mənim üçün sənin mövqeyin, Musanın yanında Harunun mövqeyi kimi olsun?! Lakin məndən sonra peyğəmbər yoxdur.”[401] Bir başqa rəvayətdə Əbu Said əl-Xudri deyir: “Allahın elçisi - salləllahu aleyhi va səlləm - Təbuk

---

[398] İbn Hişam, “əs-Sira ən-Nəbəviyyə”, 2/399; İbn Sad, “ət-Tabəqat əl-Kubra”, 2/165; əl-Bəlazuri, “Ənsəbul-Əşraf”, 1/368; İbn Həzm, “Cəvamius-Sira”, səh: 251; əd-Dimyəti, “əs-Siratun-Nəbəviyyə”, səh: 252; İbn Seyyidin-Nəs, “Uyunul-Əsər”, 2/268; İbnul-Qayyim, “Zədul-Məad”, 3/490; əs-Safədi, “əl-Vafi bil-Vafiyət”, 5/20; İbn Kəsir, “əl-Fusul fis-Sira”, səh: 210; əl-Hələbi, “əl-Muqtəfa”, səh: 220; əl-Qastalani, “əl-Məvahib əl-Ləduniyyə”, 1/421; əs-Salehi, “Subul-Hudə var-Raşəd”, 5/442;

[399] İbn Hişam, “əs-Sira ən-Nəbəviyyə”, 2/520;

[400] İbnul-Qayyim, “Zədul-Məad”, 3/703;

[401] əd-Dəvraqi, “Musnəd Sad bin Əbi Vaqqas”, (100); ən-Nəsəi, “əs-Sunən əl-Kubra”, (8082); “Musnəd Əbi Yalə”, (738) İsnadı səhihdir.

döyüşünə çıxdı və Əlini ailəsi arasında buraxdı."[402] Bir başqa rəvayətdə Sad bin Əbi Vaqqas deyir: "Peyğəmbər Cürufda düşərgə saldıqda, Əli ibn Əbu Talib silahını götürüb onun yanına gəldi və dedi: 'Ey Allahın Elçisi! Məni buraxıb getdin, halbuki bundan əvvəl heç bir döyüşdən geri qalmamışdım. Münafiqlər mənim barəmdə şayiələr yaydılar və dedilər ki, sən məni yük hesab etdiyin üçün geridə qoydun.' Sə'd dedi: Peyğəmbərin belə buyurduğunu eşitdim: 'Ey Əli! Məgər razı deyilsənmi ki, mənim üçün sənin mövqeyin, Musanın yanında Harunun mövqeyi kimi olsun?! Lakin məndən sonra peyğəmbər yoxdur. Ona görə də geri dön və ailəmin və öz ailənin başında məni əvəz et!'"[403]

**İkinci**: **Əli bin Əbi Talib əl-Quraşi əl-Haşimi** - Bu rəy İbn Abdilbərr, əz-Zəhəbi, əl-İraqi və başqalarının rəyidir.[404] Bu barədə əsaslandıqları dəlil elə mənzilə hədisinin özüdür.

**Üçüncü: İbn Ummu Məktum əl-Quraşi əl-Amiri** - Bu rəy əş-Şabi və əl-Vaqidi'yə aiddir.[405]

**Dördüncü: Sibə bin Urfuta əl-Ğifəri -** Bu isə əd-Dəravardi, İbn Hibban və tarixçi əl-Məqrizi'nin rəyidir.[406] Onun Dumətul-Cəndəl və Xeybər kimi hərbi yürüşlərdə Mədinə üzərinə əmir təyin olunması sabitdir[407], ola bilsin ki, bu səbəblə iştibah baş vermişdir.

Biz qeyd etdik ki, səhabələrin Təbuk döyüşünə çıxdığı zaman Mədinədə kimin əmir olaraq qalması məsələsində tarixçilər və hədis alimləri arasında fikir ayrılığı mövcuddur. Bu fikirləri və onları müdafiə edən alimləri sadaladıq. Bunlardan hansının daha doğru rəy olmasından asılı olmayaraq bu mövzuda daha mühüm bir sual var: əgər Əli bütün Mədinə şəhərində əmir qoyulmamışdısa, rəvayətlərin dəlalət etdiyi kimi yalnız Peyğəmbərin qohumları üzərində onu məsul şəxs kimi təyin etmişdisə bunu belə etməyinin səbəbi nə idi? Belə görünür ki,

---

402 "Tabəqat İbn Sad", 3/23-24; Dar Sadir; "Musnəd İbn Cəd", (2040); İsnadında Atiyyə əl-Avfi var, zəifdir.

403 İbn Əbi Asim, "əs-Sunnə", 2/600 (1332); əd-Dəvraqi, "Musnəd Sad bin Əbi Vaqqas", (80); İsnadı səhihdir.

404 İbn Abdilbərr, "əd-Durar fi İxtisar əl-Məğazi vas-Siyər", səh: 239; əz-Zəhəbi, "Siyər Aləm ən-Nubələ", 1/361; əl-İraqi, "Tarhut-Təsrib", 1/85;

405 əz-Zəhəbi, "Siyər Aləm ən-Nubələ", 1/361; İbn Sad, "ət-Tabəqat əl-Kubra", 2/165;

406 İbn Hişəm, "əs-Sira ən-Nəbəviyyə", 2/519; İbn Hibban, "əs-Sira ən-Nəbəviyyə va Əxbər əl-Xuləfə", səh: 367; əl-Məqrizi, "İmtəul-Əsmə", 2/50;

407 İbn Abdilbərr, "əl-İstiyəb fi Mərifətil-Əshəb", 2/682;

Təbuk kimi uzun müddətli və təhlükəli bir hərbi yürüşə çıxdığını bildiyi üçün Mədinə şəhərindəki münafiqlərin cürətini boğmaq üçün Əliyə bu vəzifəni vermişdi. Onlar Mədinədə azlıq təşkil edirdilər və ətraf bölgələrdə dəstəkçiləri də güclü deyildi. Məqsəd onları Peyğəmbərə xəyanət etmək düşüncəsindən yayındırmaq idi. Möminlər isə Mədinədən uzaq idilər və münafiqlər şəhərdən uzaqlaşaraq onu hədəf almaq üçün fürsət axtarırdılar. Peyğəmbərin Əlini geridə qoyması, onun sərt və qorxmaz bir döyüşçü olmasına görə idi. O, tərəddüd etmədən Mədinənin təhlükəsizliyini təmin edən və Peyğəmbərin əhlinə və ailəsinə qalxan olacaq bir şəxs idi. İmamilərin şeyxi əl-Mufid də "əl-İrşad" kitabında bu izahı bir qədər daha mübaliğəli şəkildə çatdırır. O deyir: "Peyğəmbər - salləllahu aleyhi və alihi - yola çıxmaq istədikdə, möminlərin əmirini - əleyhissələm - öz ailəsinə, övladlarına, zövcələri üzərində məsul şəxs təyin etdi… Bunun səbəbi isə onun - əleyhissələm - bədəvilərin və Mədinə ətrafındakı bir çox məkkəlilərin, xüsusilə də Peyğəmbərin - salləllahu aleyhi və alihi - onlarla döyüşüb qanlarını tökdüyü şəxslərin niyyətlərinin pis olduğunu bilməsi idi. Buna görə də o, Peyğəmbərin - salləllahu aleyhi və alihi - Mədinədən uzaqlaşaraq Rum torpaqlarına və ya başqa yerlərə getdiyi halda, düşmənlərin şəhərə hücum edə biləcəyindən və onun hicrət məskənində (yəni Mədinədə) fitnə-fəsad törədə biləcəyindən narahat oldu. Onun əhli-əyalına və geridə qoyduqlarına zərər vurula bilərdi. O da bilirdi ki, düşməni qorxutmaq, hicrət diyarını qorumaq və oradakıları müdafiə etmək üçün yalnız möminlərin əmiri - əleyhissələm - onun yerini tuta bilərdi."[408] Müasir şiə alimlərindən Cəfər əs-Subhani deyir: "Peyğəmbər - salləllahu aleyhi və alihi və sələm - Mədinədə **Məhəmməd bin Sələməni** özündən sonra əmir təyin etmiş olsa da, o, İmam Əliyə - əleyhissələm - belə buyurdu: "**Sən mənim əhli-beytim, hicrət evim və qövmüm üzərində xəlifəmsən.**" Beləliklə də, o sanki Mədinədə təhlükəsizlik və sabitliyi qorumaq üçün hərbi rəhbər olaraq təyin edilmiş kimi oldu."[409] Təbuk Peyğəmbərimizin hərbi məqsədlə yürüşə çıxdığı ən uzaq mənzil olub, Mədinədən çıxaraq getdiyi yerlər arasında bu qədər uzun məsafəli və məşəqqətli bir yürüşü olmamışdı. Belə uzun bir yolçuluq Mədinə üzərində xüsusi bir tədbir tələb edirdi və ona görə də İbn Məsləmə'ni ümumən əmir qoyması, Əlini - radiyallahu anhumə - isə Peyğəmbərin qohumlarının təhlükəsindən məsul şəxs seçməsi anlaşılandır. Əlbəttə ki, bu o demək

[408] əl-Mufid, "əl-İrşad", 1/155;

[409] əs-Subhani, "əs-Sira əl-Muhəmmədiyyə", səh: 220;

deyildir ki, Mədinəni real bir təhlükə, düşmənlərin hücum etmək riski gözləyirdi, çünki əks təqdirdə Mədinədən bu qədər döyüşçü alıb aparmağa və şəhəri təhlükə altında qoymağa razı olmazdı. əl-Mufid'in izahında düşmənlərin şəhərə hücumunu qeyd etməsi əsassızdır, çünki belə bir risk olsaydı Mədinədə ciddi bir müdafiə bölümü saxlanılardı, Əli - radiyallahu anhu - və bir iki nəfər səhabə şəhəri belə bir hücuma qarşı müdafiə edə bilməzdi. Amma münafiqlərin şəhərdə fəsad törətməkləri daha real bir risk idi.

Görünür ki, Mədinə şəhərində münafiqlər Əlinin geridə tərk edilməsi ilə bağlı xoşagəlməz söz-söhbət başlada bilmişdilər. Əli - radiyallahu anhu - onun üçün deyilmiş sözlərdən o qədər narahat olmuşdu ki, Mədinədən üç mil kənarda yerləşən Curf adlı yerdə geridə qalmış döyüşçüləri gözləmək üçün durmuş Peyğəmbərə - salləllahu aleyhi va səlləm - çatacaq şəkildə sürətli davranmışdı. Çatdıqda isə Peyğəmbərə "dedi: "Məni qadınlar və uşaqlar arasında xəlifə olaraq buraxacaqsan?" Peyğəmbər - salləllahu aleyhi və alihi və səlləm - buyurdu: "Məgər razı deyilsən ki, mənim üçün sənin mövqeyin Harunun Musaya olan mövqeyi kimi olsun?" Sad bin Əbi Vaqqas deyir: Bunun ardından Əli sürətlə geri döndü. Sanki ayaqlarının tozunun havaya qalxdığını görür kimi idim."[410] İmami şiələrinin böyük alimləri çox gözəl anlayırdılar ki, mənzilə hədis Əlini - kərraməllahu vachəhu - razı salmaq, onun qəlbinə təsəlli vermək məzmununda deyilmişdi. Peyğəmbər - salləllahu aleyhi va səlləm - bunu heç bir səbəb və münasibət olmadan özü söhbəti başladaraq deməmişdi, hətta Təbuka yola düşməyə əzm etdiyi üçün də deməmişdi. Lakin geridə buraxılmaqdan rahatsız olmuş, üzülmüş Əlini sakitləşdirmək üçün demişdi. Şiə alimləri bundan agah olublar. Xidir əl-Həblərudi ən-Nəcəfi (v. h. 850) yazır: "Bunun təsəlli üçün deyilmiş olması onun imamət üçün təyin olunması ilə ziddiyyət təşkil etmir və bu sözün doğruluğunu aradan qaldırmır."[411] Peyğəmbər - aleyhissalətu vassələm - əgər Əlinin könlünü rahatlatmaq, onu razı salmaq üçün bu sözləri demişdisə burada o zaman Harun ilə bənzətməyin sirri nədir? Məlumdur ki, Əlinin geridə buraxılmış olmasını xoş qarşılamamasının səbəbi müsəlmanların hamılıqla döyüşə getməsi, geridə isə yalnız asilərin, üzrlülərin, qadın və uşaqların qalmış olması idi. Dövlət başçıları döyüş üçün yürüş etdiklərində öz yanlarında ən çox fayda verə biləcəyini

[410] "Musnəd Əhməd", 3/84 (1489)

[411] əl-Həblərudi, "ət-Təvdih əl-Ənvar", səh: 135;

düşündükləri şəxsləri, fikir, dil, qol və qılınc gücü baxımından ən çox ehtiyacı olan kəsləri götürürlər. Mədinədə geridə qalmış kəslərin isə bütün bunlara ehtiyacı yox idi, çünki idarə olunacaq kütlə bu cür ağır resurslar tələb etmirdi. Ona görə də nifaq əhlindən bəzi kəslər elə güman etdilər ki, Əlinin ordu ilə birlikdə getməməsi onun üçün bir nöqsan idi, onun dəyərinin aşağılığının göstəricisi idi. "Muhəmməd həyatının ən sonuncu və ən ağır hərbi yürüşünə çıxdıqda nə üçün öz yanında əmisi oğlunu götürmədi?! Yoxsa Əli onun üçün faydasız bir yük olduğu üçün götürmədi və onu qadınlarla, uşaqlarla buraxdı?!" Peyğəmbər də - aleyhissalətu vassələm - münafiqlərin və pisniyyətli insanların bu şübhələrinə cavab vermək üçün "geridə bir kimsəni buraxmağın" nöqsan yox, fəzilət olduğunu göstərməli idi. Əgər belə bir şey nöqsan olsaydı Musa öz yerinə Harunu buraxmazdı, əksinə Musanın öz yerinə Harunu təyin etməsi bu məqamın kəramətini və əzəmətini göstərir və heç bir şəkildə bunun bir nöqsan və qüsur olmadığına dəlalət edir. Musanın Harunu öz yerinə məsul şəxs olaraq tərk etməsi ona olan etibarından və əmanətə vəfalı olmağından xəbər verir. Ona görə də buradakı bənzətmə "istixləfin", yəni öz yerinə bir kimsəni təyin etməyin əsli ilə bağlıdır, onun keyfiyyəti və tərkib hissələri ilə əlaqəli deyildir, çünki Musa öz qardaşı Harunu bütün İsrail oğulları üzərində məsul şəxs təyin etmiş və tək başına Rəbbi ilə görüşməyə getmişdi. Peyğəmbər isə - salləllahu aleyhi va səlləm - Əlini müsəlmanların bir hissəsi üzərinə təyin etmiş və onların əsas hissəsini özü ilə birlikdə döyüşə aparmışdı. Peyğəmbərin Əliyə "razı deyilsənmi ki…?" sualı ilə cümləsini başlaması və Əlinin də "razı oldum"[412] şəklində cavab verməsi də dəlalət edir ki, burada Allahın elçisinin - aleyhissalətu vassələm - məqsədi Əliyə verdiyi vəzifənin fəzilətini göstərməklə onu razı salmaq idi.

Bu mövzuda araşdırmaları ilə tanınan sünni müəlliflərdən Muhəmməd Səlim əl-Xidr yazır ki, mənzilə hədisi və onun dəlalət etdiyi məna barəsində firqələr arasında geniş bir müzakirə olsa da imamiyyə şiələrinin qədim alimlərindən heç kim mənzilə hədisinin Təbuk döyüşünə xas olduğunu inkar etməyib. Hətta Əbul-Məcd əl-Hələbi mənzilə hədisindən danışarkən onu "təbuk yürüşü nassı" adlandırır.[413] Bunun böyük ölçüdə mütəaxxir alimlər üçün də keçərli olduğunu deyir. Fəqət burada Əli bin Yunus əl-Bəyadi əl-Amili (vəfatı h. 877) adlı alimi

---

[412] ət-Tusi, "əl-Əməli", səh: 171; ət-Tabrasi, "İləmul-Vara", səh: 122;

[413] əl-Hələbi, "İşəratus-Səbq", səh: 53;

istisna edir,[414] beləki "əs-Sirat" kitabında əl-Amili iddia edir ki, peyğəmbər - salləllahu aleyhi va əlihi va səlləm - mənzilə hədisindəki sözləri birdən çox məzmunda və tarixdə deyib və ona görə bunların ən sonuncusu Təbuk yürüşündə təkidlə dediyi sözlərdir. əl-Bəyadi bu fərqli yerlərin hansıları olduğunu bəyan etmir, onlara sadəcə olaraq işarə edir.[415] Qeyd etməyimiz lazımdır Muhəmməd Səlim əl-Xidr'in gəldiyi nəticə yalnışdır, əl-Bəyadi əl-Amili bunu deyən ilk şiə alimi olmayıb. Seyyid İbn Zəhra əl-Hələbi (h. 511-585) "Ğunyətun-Nuzu" kitabında və müasiri Şeyx Sədiduddin Mahmud bin Əli əl-Himzi ər-Razi (vəfatı təxminən h. 606) "əl-Munqiz minət-Təqlid" kitabında bu mənanın eynisini təsdiqləyirlər və isbat etmək istəyirlər ki, Peyğəmbər – aleyhissalətu vassələm – bu sözləri Əli haqqında hansısa bir səbəbə görə deməmişdi, lakin bunu fərqli vaxtlarda təkrarlayıb, amma bu iddiası üçün heç bir dəlil gətirmir.[416] Müasir şiə alimlərinin bir hissəsi onların bu iddiasını inkişaf etdirərək onun üçün fərqli yerləri müəyyən etməyə çalışıblar. Abdulhüseyn Şərəfuddin (vəfatı h. 1377) "əl-Muracəat" kitabında bu sözlərin varid olduğu altı fərqli yerin olduğunu deyir.[417] Daha sonra Əli əl-Miləni onun yolunu izləmiş və bu hədisdəki sözlərin on ayrı yerdə deyildiyini irəli sürmüş və əlavə etmişdir: "Bu yerlər daha çoxdur, mən onları bir-bir araşdırdım və qeydə aldım, lakin sözümüzü qısa tutmaq məqsədilə burada bu miqdarı ilə kifayətlənirəm."[418] Cəfər Murtəda əl-Amili isə sözünü ixtisar etmək məqsədi olmadığı üçün bu sözlərin deyilmə yerlərindən iyirmi birini təsbit etmişdir.[419] Görünür ki, mütəaxxir şiə alimləri burada bir problemin olduğunu təşxis etdikləri üçün belə bir cəhdə baş vurublar. Çünki əgər mənzilə hədisi Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - özündən sonra bir xəlifə və möminlərin başına bir əmir etmək cəhdi idisə bunu nə üçün bir təsəlli, şikayət üzərindən razı salmaq məzmununda deyirdi?! Bunu nə üçün Mədinədə ikən təyinat olduğu başa düşüləcək şəkildə hamının qarşısında daha açıq sözlərlə ifadə etmir, lakin Mədinədən kənarda Curf deyilən bir yerdə bir bənzətmə şəklində ifadə edir?! Bu problemi görmüş şiə alimləri cavab olaraq deyiblər ki, Peyğəmbər - aleyhissələm - bunu yalnız Təbuk döyüşündə deməyib, başqa münasibətlərdə də deyib. Şiə alimlərin bu nöqtəni isbat

---

[414] əl-Xidr, "Hədisul-Mənzilə", səh: 77;

[415] əl-Bəyadi, "əs-Sirat əl-Mustəqim", 1/319;

[416] əl-Hələbi, "Ğunyətun-Nuzu", 2/177; əl-Himsi, "əl-Munqiz minət-Təqlid", 2/355

[417] Şərəfuddin, "əl-Muracəat", səh: 207;

[418] əl-Miləni, "Nəfəhətul-Əzhər", 17/281-286;

[419] əl-Amili, "əs-Sahih min Sirati əl-İmam Əli", 6/282-287;

etmək üçün əsaslandıqları dəlillərə nəzər saldığımızda görürük ki, bunlar ya 1) mövzu ilə əlaqəsi olmayan hədisdir, orada ümumiyyətlə mənzilə sözləri yoxdur, ya 2) isnadı səhih olsa da, onun Təbukdan başqa vaxtda deyildiyinə dair kiçik bir işarə belə yoxdur, ya 3) isnad baxımından etibarsız və hətta uydurmadır, yaxud da 4) imamiyyə şiələrinin başqalarına müxalif olaraq təkbaşına rəvayət etdikləri xəbərlərdir. Birinci növə gəldikdə bu, məşhur "dar hədisidir" ki, əl-Milani onu mənzilə hədisinin dəlilləri arasında zikr edir, halbuki "dar hədisində" Əlinin Haruna bənzədilməsi ilə bağlı heç bir şey keçmir. İkinci növə isə Əsma bint Umeys'in hədisini göstərirlər ki, orada Əsma bint Umeys deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - Əliyə dedi: "Ey Əli, sənin mənə nisbətdə mərtəbən Harunun Musaya olan mərtəbəsidir, lakin məndən sonra bir peyğəmbər yoxdur."[420] Qeyd etdiyimiz kimi bu hədis səhihdir, lakin bunun Tabukdan başqa bir zaman deyildiyinə dair heç bir dəlil və ya işarə yoxdur.

Üçüncü növdə birdən çox hədis zikr olunub. Bunlardan biri yenə Ummu Sələmədən gəlir. İbn Abbasın Peyğəmbərdən nəql etdiyinə görə, Peyğəmbər - salləllahu aleyhi və səlləm - Ummu Sələməyə belə buyurdu: "Ey Ümmü Sələmə! Həqiqətən, Əli mənim ətimdəndir, qanı mənim qanımdandır. O, mənim üçün Harunun Musa üçün olan məqamındadır, lakin məndən sonra peyğəmbər yoxdur."[421] Bu hədisin isnadı çox zəifdir, çünki isnadındakı ravilər şiddətli şəkildə cərh olunmuş ravilərdir. Üstəlik bu hədisdə də sözlərin Tabuk məzmunundan tamamilə fərqli bir yerdə deyildiyinə dair bir dəlil

---

[420] "Musnəd Əhməd", 27081 və 27467

[421] Bunu əl-Uqeyli "əd-Duafə əl-Kəbir" (2/47) və İbn Adiy "əl-Kəmil fi Duafə ər-Ricəl" kitabında (5/379) rəvayət ediblər. İsnadındakı Abdullah bin Dəhir ər-Razi haqqında Yəhya bin Main deyib: "Xeyir sahibi olan heç bir insan onun hədisini yazmaz." İbn Adiy də buyurur: "Rəvayət etdiklərinin hamısı Əlinin fəzilətləri haqqındadır və o, bunda ittiham olunub." İsnadında həmçinin atası Dəhir bin Yəhya ər-Razi də yer alır ki, əl-Uqeyli onun haqqında deyir: "Hədisini başqaları dəstəkləmir." Onun üçün bir çox hədis zikr edir və buyurur ki, hamısı məhfuz deyildir. İsnadında həmçinin Abəyə əl-Əsədi adlı ravinin adı keçir və İbn Abbas'dan bunu rəvayət edən odur. Onun haqqında əl-Uqeyli deyir: "Aşırıdır, mülhiddir." Mülhid sözünü burada dinsiz mənasında başa düşmək olar. Bunu həmçinin ət-Təbərani "əl-Mucəm əl-Kəbir" kitabında (12341) rəvayət edir. İsnadında Həsən bin Hüseyn əl-Arani adlı bir ravi var. Onun haqqında İbn Adiy deyir: "Onun münkər hədisləri var, çoxlu hədis rəvayət edir ki, hədisi siqa ravilərin hədisinə bənzəmir." İbn Hibban isə deyir: "Kufəlilər vasitəsi ilə əl-Aməş'dən məqlub hədislər rəvayət edir." Bu hədisi də o, Yəhya bin İsa ər-Ramli vasitəsi ilə əl-Aməş'dən rəvayət edib. Yəhya bin İsa ər-Ramli'yə gəldikdə isə onu Yəhya bin Main, ən-Nəsai kimi alimlər zəif sayıblar və İbn Adiy onun hədislərini araşdıraraq buyurub ki, "rəvayət etdiklərinin hamısında onu dəstəkləyən (başqa ravilər) yoxdur."

yoxdur. İbn Abbasa nisbət edilən bir başqa rəvayətdə o, buna bənzər sözləri Ömər bin əl-Xattab'dan rəvayət edir. Abdullah ibn Abbas nəql edir ki, Ömər ibn Xəttab belə deyib: "Əli ibn Əbu Talibin adını ağzınıza almayın (yəni söyməyin), çünki mən Peyğəmbərin - salləllahu aleyhi və səlləm - onun barəsində belə dediyini eşitdim: 'Əli haqqında elə üç xüsusiyyət vardır ki, onlardan birinin belə məndə olması mənim üçün üzərinə günəş doğan hər şeydən daha sevimlidir.'" Ömər dedi: "Mən, Əbu Bəkr, Əbu Ubeydə ibn Cərrah və Peyğəmbərin bir neçə səhabəsi birlikdə idik. Peyğəmbər - salləllahu aleyhi və səlləm - Əli ibn Əbu Talibə söykənmişdi və əlini onun çiyninə vuraraq buyurdu: 'Ey Əli! Sən iman gətirənlərin ilki, İslamı qəbul edənlərin birincisisən. Sən mənim üçün Harunun Musa üçün olduğu məqamdasan.'"[422] Bu rəvayət münkərdir. Daha bir rəvayətdə Zeyd ibn Əbi Övfə nəql edir: "Peyğəmbərin məscidinə daxil oldum. O, səhabələri arasında qardaşlıq bağladığını xatırlatdı. Əli Peyğəmbərə dedi: 'Sən səhabələrin arasında qardaşlıq bağladın, amma məni buraxdın. Bu hal mənim ruhumu aldı və belimi qırdı. Əgər bu, mənə qarşı bir narazılıqdan irəli gəlirsə, sənin razılığın və kərəmin mənə yetər.' Peyğəmbər buyurdu: 'Məni haqq ilə göndərən Allaha and olsun ki, səni yalnız özüm üçün saxladım. Sən mənim üçün Harunun Musa üçün olduğu kimisən, yalnız məndən sonra peyğəmbər yoxdur. Sən mənim qardaşım və varisimsən.' Əli dedi: 'Mən səndən nəyi irs aparacağam, ya Rəsulallah?' Peyğəmbər buyurdu: 'Məndən öncəki peyğəmbərlərin miras qoyduğu şeyi.' Əli dedi: 'Məndən öncəki peyğəmbərlər nəyi miras qoydular?' Peyğəmbər buyurdu: 'Allahın Kitabını və onların peyğəmbərlik sünnəsini. Sən mənimlə birlikdə cənnətdə bir sarayda olacaqsan, qızım Fatimə ilə bir yerdə. Sən mənim qardaşım və dostumsan.' Sonra Peyğəmbər bu ayəni oxudu: *'Qardaş olaraq taxtlar üzərində qarşı-qarşıya oturarlar.'* (Hicr, 47) Allah üçün bir-birini sevənlər bir-birinə baxaraq xoşbəxt olacaqlar.'"[423] Bu hədis də isnad baxımından çox problemlidir, üstəlik

---

[422] Bu, münkər bir hədisdir. Bunu Əbu Əhməd əl-Hakim "əl-Əsami val-Kunə" kitabında (3/53) rəvayət edir. Bunu Əbu Əhməd əl-Hakim Bağdad şəhərində Əbul-Həsən Əli bin əl-Mubərak əl-Məsruri'dən, o da İbrahim bin Said əl-Cəvhəri'dən rəvayət edir. İbrahim deyir: "Möminlərin əmiri əl-Məmun mənə rəvayət etdi; dedi: Möminlərin əmiri ər-Raşid mənə rəvayət etdi; dedi: Möminlərin əmiri əl-Mehdi mənə rəvayət etdi; dedi: Möminlərin əmiri əl-Mənsur mənə rəvayət etdi; dedi: Atam mənə babasından, o da Abdullah bin Abbas'dan rəvayət etdi." Bu isnaddakı ravilərin çoxu abbasi xəlifələri və onların əcdadıdır. Onların haqqında sünnilərdən qabaq şiə alimlərinin rəyi məlumdur.

[423] Bunu İmam Əhməd'in oğlu Abdullah atasının "Fədail əs-Sahabə" kitabına etdiyi əlavələrdə (1085 və 1137) gətirir. İsnadında Abdulmumin bin Abbad əl-Abdi var; Əbu Hatim onu zəif saymış, əl-Buxari onun haqqında "hədislərində tabe olunmur" demişdir. əs-

mətnində də ciddi problemlər var. İbn Teymiyyə mətndəki bu problemi təsbit edərək buyurur: "Bu hədisdə yer alan "Sən mənim qardaşımsan və varisimsən" ifadəsi həm Əhli-sünnənin, həm də Şiələrin fikrinə görə batildir. Əgər burada miras olaraq mal-mülk nəzərdə tutulursa, bu, onların "Fatimə onu miras aldı" iddiasını batil edər. Çünki əmisi Abbas sağ ikən əmioğlu necə mirasçı ola bilər? Üstəlik, Əlinin digər əmioğullarından hansı xüsusiyyətinə görə mirasçı seçildiyi də məlum deyil, halbuki onlar eyni dərəcədədirlər. Əgər burada irs mirası deyil, elmin və vilayətin mirası nəzərdə tutulursa, bu halda onların Süleymanın Davuda varis olması haqqında deyilən **"Süleyman, Davuda varis oldu"** (Nəml, 16) ayəsinə və Zəkəriyyə peyğəmbərin **"Ey Rəbbim, Öz tərəfindən mənə bir varis ver, o, mənə və Yaqub nəslinə varis olsun"** (Məryəm, 5-6) duasına istinad etmələri batil olar. Çünki "miras" kəlməsi həm maddi mirasa, həm də mənəvi mirasa işarə edə bildiyi üçün, bu peyğəmbərlərin miras almasından, Əlinin də Peyğəmbərin mirasını eyni mənada miras aldığına dəlil gətirmək mümkündür."[424] Mətndəki bu problem tələb edir ki, hədisin mətni nə əhlüs-sünnətə görə, nə də şiələrə görə doğru olmamalıdır. Lakin hədisin isnadı zəif və məchul ravilərdən ibarət olduğu üçün mətni üzərində çox dayanmağa ehtiyac yoxdur. Təəssüf edici hal şiə müəlliflərin bu kimi hədisləri gətirərək mənzilə hədisinin fərqli yerlərdə deyildiyini isbat etmək istəkləridir.

Burada bir başqa rəvayət də gətirilir və onun mətni uzundur. Bu rəvayəti Məhduc ibn Zeyd birbaşa Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - belə rəvayət edir: "Peyğəmbər - salləllahu aleyhi və səlləm - müsəlmanlar arasında qardaşlıq bağladı, sonra buyurdu: "Ey Əli! Sən mənim qardaşımsan və mənim üçün Harunun Musaya olan nisbəti kimisən, lakin məndən sonra peyğəmbər yoxdur. Bilirsənmi, ey Əli, Qiyamət günü çağırılacaq ilk şəxs mən olacağam? Mən ərşin sağ tərəfində Onun kölgəsində dayanacağam və mənə cənnət libaslarından

---

Səci və İbnul-Carud onu zəif ravilər arasında qeyd ediblər. Üstəlik Yezid bin Mən adlı məchul bir ravidə mövcuddur. Bir yerdə bu hədisi Abdullah bin Şurahbil birbaşa Zeydin özündən rəvayət etdiyi halda, başqa yerdə arada adını çəkmədiyi bir nəfərdən rəvayət etdiyi keçir. İbn Teymiyyə "Minhəcus-Sunnə" kitabında (7/279) deyir: "Bu isnad muzlimdir. Onu təkcə Abdulmumin bin Abbad rəvayət etmişdir ki, o da tənqid olunan ravilərdən biridir. Əbu Hatim onu zəif hesab etmişdir. Rəvayətin digər ravisi Yezid ibn Mən isə naməlumdur; ola bilsin ki, bu hədisi Abdullah ibn Şurahbildən uyduran odur, o da məchul biridir. Həmçinin rəvayət qureyşli (naməlum) bir nəfərdən nəql olunur, o isə Zeyd ibn Əbi Övfədən rəvayət edir."

[424] İbn Teymiyyə, "Minhəcus-Sunnə ən-Nəbəviyyə", 7/280-281;

yaşıl bir libas geydiriləcək. Sonra peyğəmbərlər bir-bir çağırılacaq, onlar ərşin sağ tərəfində iki sıraya düzüləcəklər və onlara da cənnətdən yaşıl libaslar geydiriləcək. Ey Əli! Sənə xəbər verim ki, mənim ümmətim Qiyamət günü hesaba çəkilən ilk ümmət olacaq. Müjdə olsun sənə, ey Əli! Sən də çağırılacaq ilk şəxs olacaqsan, çünki sən mənə qohumsan (və ya yaxınsan) və mənim yanımda xüsusi mövqeyin var. O zaman sənə mənim bayrağım, Həmd Bayrağı veriləcək və sən onu apararaq o iki sıranın arasından keçəcəksən. Adəm - əleyhissəlam - və Allahın bütün məxluqları mənim bayrağımın kölgəsinə sığınacaq. Bu bayraq min illik məsafə uzunluğundadır. Onun ucu qırmızı yaqutdan, gövdəsi ağ gümüşdən, nizəsi isə yaşıl incidən hazırlanmışdır. Onun üç parlaq saç kimi işıq saçan ucu var: biri şərqdə, biri qərbdə, biri isə dünyanın mərkəzindədir. Üzərinə üç sətir yazılmışdır: **Bismillahir-Rahmənir-Rahim** (Allahın adı ilə, Rəhman və Rəhim), **Əl-həmdü lillahi Rabbil-`aləmin** (Həmd olsun aləmlərin Rəbbinə), **Lə ilahə illəllah, Muhəmmədun Rasulullah** (Allahdan başqa ibadətə layiq ilah yoxdur, Muhəmməd Allahın Rəsuludur). Hər bir sətirin uzunluğu min illik yol məsafəsinə bərabərdir və eni də min illik yol məsafəsinə bərabərdir. Sən bu bayrağı aparacaqsan və sağında Həsən, solunda Hüseyn olacaq, ta ki, ərşin kölgəsində mənimlə İbrahim - əleyhissəlam - arasında dayanacaqsan. Sonra sənə də cənnətdən yaşıl bir libas geydiriləcək. Sonra ərşin altından bir nida edən səslənəcək: "**Nə gözəl atandır sənin atan – İbrahim! Və nə gözəl qardaşdır sənin qardaşın – Əli!"** Müjdə olsun sənə, ey Əli! Sənə libas geydiriləndə, mənə də geydiriləcək. Sən çağırılanda, mən də çağırılacağam. Sənə salam veriləndə, mənə də salam veriləcək!"[425] Bu rəvayət əl-Qatii'nin "Fədailus-Sahabə" kitabına əlavələrindəndir. Məhduc bin Zeyd haqqında İbn Həcər qeyd edir ki, "o, əl-Bəhili'dir; altıncı təbəqədən məchul bir ravidir və onun səhabə olduğunu iddia edənlər xəta ediblər."[426] Bu hədisin həm mətninə, həm də isnadına nəzər salmaq onun uydurma rəvayət olduğunu görmək üçün kifayət edir. Çünki isnadında əl-Həsən bin Əli əl-Adəvi əl-Basri adlı bir ravi vardır ki, hədis uydurmaqla tanınır.[427]

---

[425] Əhməd, "Fədail əs-Sahabə", (1131)

[426] İbn Həcər, "Təqribut-Təhzib", (6498) İbnul-Məğazili "Mənaqib Əli" kitabında (səh: 94) bu rəvayəti Əbu Zeyd əl-Bəhili'dən rəvayət edir və bu bir xətadır. Doğru olan Məhduc bin Zeyd əl-Bəhilidir.

[427] İbn Hibban "əl-Məcruhin" kitabında (223) deyir: "Əl-Həsən ibn Əli ibn Zəkəriyyə Əbu Səid əl-Adəvi, Bəsrədən olub Bağdadda yaşamışdır. O, görmədiyi şeyxlərdən rəvayət edirdi

Şiə müəlliflərin zikr etdikləri daha bir rəvayət belədir: Hüzeyfə bin Əsîd əl-Ğifârî rəvayət edir: “Səhabələr Peyğəmbərlə birlikdə Mədinəyə gəldikdə, gecələyə biləcəkləri evləri yox idi, buna görə də məsciddə gecələyirdilər. Peyğəmbər onlara dedi: "Məsciddə yatmayın ki, ihtilam olmayasınız." Sonra səhabələr məscidin ətrafında evlər tikdilər və qapılarını məscidə açdılar. Peyğəmbər Muaz bin Cəbəli onların yanına göndərdi. Muaz Əbu Bəkrin yanına gəlib dedi: "Rəsulullah sənə məsciddən çıxmağı əmr edir." Əbu Bəkr dedi: "Eşitdim və itaət etdim." O, qapısını bağladı və məsciddən çıxdı. Sonra Muaz Ömərin yanına gəldi və dedi: "Rəsulullah sənə məsciddən çıxmağı və qapını bağlamağı əmr edir." Ömər dedi: "Eşitdim və itaət etdim, lakin Allahdan məsciddə kiçik bir pəncərə üçün icazə verməsini diləyirəm." Muaz bu istəyi Peyğəmbərə çatdırdı. Sonra Muaz Osman bin Əffanın yanına gəldi. O, həmin vaxt Rüqəyyə ilə birlikdə idi. O da dedi: "Eşitdim və itaət etdim." Qapısını bağladı və məsciddən çıxdı. Daha sonra Muaz Həmzənin yanına getdi. Həmzə də qapısını bağlayıb dedi: "Allah və Rəsuluna itaət etdim." Lakin Əli (əleyhissəlam) tərəddüd edirdi, bilmir, məsciddə qalmalı, yoxsa çıxmalı idi. Peyğəmbər onun üçün məsciddə, digər səhabələr üçün tikilmiş evlərin arasında bir ev tikmişdi. Peyğəmbər ona dedi: "Təmiz və pak olaraq burada qal." Bu xəbər Həmzəyə çatdıqda, o dedi: "Ey Muhəmməd! Bizi çıxarırsan, amma Əbdülmüttəlib oğullarının gənclərini saxlayırsan?" Peyğəmbər ona dedi: "Xeyr! Əgər iş mənim əlimdə olsaydı, heç kimi səndən üstün tutmazdım. Allaha and olsun ki, Allah özü bu məqamı ona verdi. Sən də Allah və Onun

---

və gördüyü şeyxlərin adından hədislər uydururdu. Bağdadda bizim dövrümüzdə yaşayırdı. Mən onun hədislərini sınamaq üçün onun özündən dinləməyi istədim və onun hədislərindən bir cüz götürdüm. Onun Əbu ər-Rabi əl-Zəhrani və Muhəmməd ibn Abd ibn əl-Alə əs-Sanani’dən rəvayət etdiyini gördüm; dedilər: "Bizə Abd ər-Razzaq nəql etdi, o da Mə’mərdən, o da əz-Zühridən, o da Urvədən, o da Əbu Bəkr əs-Siddiqdən rəvayət etdi ki, Rəsulullah - sallallahu aleyhi və səlləm - buyurdu: 'Əliyə baxmaq ibadətdir.'" Bu elə bir şeydir ki, hədis əhlindən adi insanlar belə bunun uydurma olduğuna şəkk etmirlər. Çünki əs-Siddiq (Əbu Bəkr) heç vaxt belə bir xəbər rəvayət etməmişdir. Həmçinin, onun rəvayətçiləri və Urvə bu hədisi nəql etməmişdir. Zühri də bunu zikr etməmişdir, Mə’mər də bunu söyləməmişdir. Belə bir hədisi əl-Zəhrani və əs-Sanani kimi Bəsrə əhlinin ən usta ravilərinin adından hər kim uydurubsa tərk olunmağa layiqdir.” Həmçinin İbn Adiy “əl-Kəmil” kitabında (474) onunla bağlı deyir: “O, hədislər uydurur, hədisləri oğurlayır və onları başqa insanlara aid edərək təqdim edirdi. O, tanımadığı insanlardan rəvayət edirdi və Allahın heç zaman yaratmadığı şəxsləri uydurmaqla ittiham olunurdu.” Üstəlik bu rəvayətin isnadında əl-Hüseyn bin Raşid ət-Tufəvi və əs-Sabbah bin Abdilləh adlı iki məchul ravi var. Bunlar rəvayəti Qeys bin ər-Rabi’dən rəvayət edirlər ki, onun haqqında ixtilaf var. O isə Sad əl-Xaffəf adlı zəif ravidən rəvayət edir, Sad əl-Xaffəf də zəifliyi ilə tanınmış Atiyyə əl-Avfi’dən rəvayət edir. Əslində bu ravilərin zəifliyinə və etibarlılığına ehtiyac yoxdur, çünki bu hədisin əsas fəlakəti əl-Həsən bin Əli əl-Adəvi’dir.

Rəsulunun xeyir və müjdəsi içindəsən." Sonra Peyğəmbər ona müjdə verdi və Həmzə Uhud döyüşündə şəhid oldu. Bu məsələ bəzi kişilərin Əliyə qarşı qısqanclıq etməsinə səbəb oldu. Onlar bu vəziyyətdən narahat oldular və onun fəzilətinin onlardan və digər səhabələrdən üstün olduğunu açıq şəkildə gördülər. Bu xəbər Peyğəmbərə çatdıqda, o, ayağa qalxıb xütbə oxudu və dedi: "Bəzi kişilər Əlinin məsciddə qalmasına görə narahat olurlar. Allaha and olsun ki, nə onları çıxaran mən oldum, nə də Əlini məsciddə saxlayan mən oldum! Allah Musa və qardaşına belə vəhy etdi: "Camaatınız üçün Misirdə evlər tikin, evlərinizi namazgah edin və namaz qılın. " [10:87] Allah Musaya əmr etdi ki, məscidində heç kim yaşamasın, orada evlənməsin və ora yalnız Harun və onun övladları daxil olsun. Əli mənim üçün Harunun Musaya olan məqamındadır. O, mənim qardaşımdır, ailəmdən də üstündür. Mənim məscidimdə qadınlarla nikah bağlamaq yalnız Əli və onun övladlarına halal edilmişdir. Bu sizi narahat edirsə, bax, o tərəfə gedin!" Peyğəmbər əli ilə Şama işarə etdi."[428] Bu hədis isnad baxımından zəif[429], mətn baxımından münkərdir, çünki mətninə inanmalı olsaq bu hadisə Həmzə şəhid edilmədən, yəni Uhud döyüşündən əvvəl baş verib. Halbuki məsciddə qapıların bağlanması hadisəsi Mədinə dönəminin axırlarında baş verib. Üstəlik belə bir hadisənin digər səhabələr tərəfindən yox, məhz Huzeyfə bin Əsir əl-Ğifəri kimi hicrətdə iştirak etməmiş bir səhabənin rəvayət etməsi də qəribədir.

Bu məqsəd üçün gətirilən daha bir rəvayəti İbn Asəkir tarixində Cabir bin Abdilləh əl-Ənsari'dən rəvayət edir: "Bizə Allahın Rəsulu gəldi. Biz o vaxt məsciddə uzanmışdıq. Onun əlində yaş xurma budağı vardı. O, bizi onunla vurdu və dedi: 'Məsciddə yatırsınız? Məsciddə heç kim yatmamalıdır.' Biz tez qalxdıq və bizimlə birlikdə Əli ibn Əbu Talib də qalxdı. Bunun üzərinə Allahın Rəsulu dedi: 'Gəl, ya Əli! **Sənin üçün məsciddə halal olan şeylər, mənim üçün halal olanlar kimidir.** Ya Əli, sən razı deyilsənmi ki, mənim üçün **Harunun Musa üçün olan məqamında olasan?** Lakin məndən sonra peyğəmbərlik yoxdur. Və canım əlində olan Allaha and olsun ki, sən Qiyamət günü

[428] İbnul-Məğazili, "Mənaqib Əli", (303)

[429] İsnadında Sələm bin Əbi Amra var. İbn Məin dedi: "Onun hədisi bir şey deyil." Yəqub ibn Sufyan onun haqqında "rəvayət etməkdən çəkinilən şəxslər" bölümündə qeyd etmişdir. Əzdi dedi: "Hədisdə zəifdir" İbn Hibbân onu "əl-Məcruhin" (zəif ravilər) kitabında (426) qeyd edərək dedi: "O, etibarlı ravilərdən çevrilmiş (dəyişdirilmiş, səhv) hədislər rəvayət edər. Onun xəbəri ilə dəlil gətirmək caiz deyil." İsnadında həmçinin Cəfər bin Abdilləh bin Muhəmməd adlı məchul bir ravi var.

hovuzumdan bəzi insanları, azğın dəvənin sudan uzaqlaşdırıldığı kimi uzaqlaşdıracaqsan. Bəziləri sənin yanında kolların içində olacaqlar. Mən sənin hovuzumun yanında dayanmağını indidən görürəm."[430] Bu rəvayət isnad baxımından zəif olmaqla yanaşı mətnindəki "Harunun Musaya nisbəti" hissəsinin sonrakı ravilər tərəfindən əlavə edilmiş olduğu görünür. Çünki bunu Əhməd bin Məni əl-Bəğavi (vəfatı h. 244) "əl-Musnəd" kitabında[431] həmin əlavə sözlər olmadan rəvayət edir. Aydın olur ki, bütün bu rəvayətlərin içində mənzilə hədisinin Təbuk'dan başqa yerdə deyildiyinə dair heç bir dəlil yoxdur. Əksinə əlimizdə olan dəlillər göstərir ki, bu sözlər məhz Təbukda deyilib.

Mənzilə hədisinin dəlalətinə gəldikdə isə bu barədə imami şiələri çox mürəkkəb sərf ediblər. Onlar deyirlər ki, hədisin dəlalətinə əsasən istisna olunandan savayı Haruna aid xüsusiyyətlərin hamısı Əli üçün də isbat edilməlidir. Burada istisna olunan tək peyğəmbərlik olduğu üçün geri qalan digər xüsusiyyətlər sabit olmalıdır.Deyirlər ki, Qurana baxdığımızda Musaya nisbətdə Harunun dörd məqamı olub: Birinci peyğəmbərlik məqamıdır. Allah - təalə - buyurur: "**Biz Öz mərhəmətimizdən ona qardaşı Harunu da bir peyğəmbər olaraq bəxş etdik.**" [19:53] Ikincisi vəzirlik məqamıdır. Bunu Allah - cəllə cəlaluhu - Musanın dili ilə belə buyurur: "**Həqiqətən, Kitabı Musaya Biz verdik və qardaşı Harunu da ona köməkçi (vəzir) etdik.**" [25:35] Üçüncüsü islah edici xəlifədir. "Musa qardaşı Haruna dedi: "**Camaatımın içərisində məni əvəz et, (onları) islah et və fəsad törədənlərin yoluna uyma!**" [7:142] Dördüncüsü isə dəstəkçi müstəşar məqamıdır. "**Mənə öz ailəmdən bir köməkçi ver. Qardaşım Harunu! Onun sayəsində mənim gücümü artır! Onu işimə ortaq et...!**" [20:29-32] İmami şiələri deyir ki, hədisdə istisna olunan nübuvvət məqamından başqa burdakı məqamların hamısını Əli üçün isbat olunur, çünki nübuvvətin istisna olunması ləfzin ümumiliyinə dəlalət edir. Örf yolu ilə bilirik ki, Əli peyğəmbərin ana və ata tərəfdən qardaşı olmayıb, beləliklə də bunu hədisdən yox, örf ilə və ya əql ilə

---

[430] İbn Asəkir, "Tərixu Diməşq", 42/139-140; İbn Asəkir'in isnadında Əhməd bin Hüseyn bin Cəfər əl-Ləhəbi adlı məchul ravi var. Bir digər ravi Abdulaziz bin Muhəmməd əd-Dəravardi isə hafizəsindən rəvayət etdikdə xətalar etməklə tənqid olunub. Lakin əsas problem Haram bin Osman adlı ravidir ki, onun haqqında əş-Şafi - rahiməhullah - deyib: "Haramdan hədis rəvayət etmək haramdır." Yəhya bin Main onun siqa olmadığını deyib, Əhməd bin Hənbəl isə "insanlar onun hədisini tərk ediblər" deyib. İbn Adiy isə deyir: "Hədislərinin hamısı münkərdir."

[431] Bax: əl-Busiri, "İthəful-Məhərə" (1029) və İbn Həcər, "əl-Mətalib əl-Aliyyə" (3948)

bilirik. Harunun məqamlarından biri də bu idi ki, ona itaət etmək fərz idi. Beləliklə də bu cür izah verən şiə alimləri peyğəmbərlikdən başqa bu xüsusiyyətlərin hamısını Əli üçün isbat edirlər.[432] Bəziləri isə bunu yalnız bir məna ilə xüsusiləşdirirlər. Misal üçün İbn Şəhriəşub deyir: "Burada mövzu üç mənadan kənara çıxmır: Ya o, Harun kimi peyğəmbərdir, ya onun ata və anadan olan qardaşıdır, ya da onun ümmətindəki xəlifəsidir. Çünki Musa ilə onun arasında ancaq bu münasibətlər vardır. Belə ki, nübüvvət məqamı batil olduğuna və ata-anadan qardaşlıq da mümkün olmadığına görə, üçüncü məqam sabit olur ki, o da xəlifəlikdir. Necə ki, (Quranda) 'Qövmüm arasında mənim yerimə keç' (ifadəsi gəlmişdir). Üç mənadan biri və ya ikisi batil olarsa, üçüncüsü sabit olar."[433] Lakin şiələrdə məşhur olan izah birincidir. Müasir şiə alimlərdən Cəfər əs-Subhani də deyir: "Peyğəmbər - salləllahu aleyhi və alih - Əlinin - aleyhissəlam - özünə olan məqamını Harunun Musaya - aleyhiməssalam - olan məqamı ilə eyni tutmuş və Harunun Musaya nisbətdə malik olduğu məqam və dərəcələrdən yalnız nübüvvəti istisna etmişdir. Belə ki, o buyurmuşdur: 'Ya Əli, məndən sonra Harunun Musaya olan məqamında olmağına razı deyilsənmi? Lakin məndən sonra peyğəmbər yoxdur.' Bu inkar və istisna, əslində, 'mövzunun mövcud olmaması səbəbilə inkar' (السالبة بانتفاء الموضوع) növündəndir. Çünki Peyğəmbər - salləllahu aleyhi və alih - sonuncu peyğəmbər olduğu üçün, ondan sonra artıq peyğəmbərlik yoxdur ki, Əli ondan sonra peyğəmbər olsun. Çünki İslam Peyğəmbəri ilə peyğəmbərlik tamamlanmış, onun şəriəti ilə isə şəriətlər sona çatmışdır. Harun isə - Qurani-Kərimdə açıq şəkildə bildirildiyi kimi - Musa dövründə peyğəmbərlik, xilafət və vəzirlik məqamına malik idi. 'Mənzilə hədisi' isə bu məqamların hamısını - peyğəmbərlik istisna olmaqla - İmam Əliyə - aleyhissəlam - aid etmişdir. Əgər bu hədisin məqsədi Əliyə bütün məqamları - peyğəmbərlik istisna olmaqla - isnad etmək olmasaydı, onda nübüvvətin istisna edilməsinə heç bir ehtiyac olmazdı."[434] Bəziləri qeyd edir ki, Peyğəmbər - aleyhissalətu vassələm - bu hədisdə Əlini özündən sonra insanların üzərində xəlifə təyin etmiş, sonra onu vəzifəsindən çıxarmamışdır və vəfatından sonra da bu vəzifənin üzərində qalmışdır.[435] Əgər Harunun Musadan sonra sağ

[432] ət-Tusi, "əl-İqtisad", səh: 222; Əbul-Məcd əl-Hələbi, "İşəratus-Səbq", səh: 53; Şərəfuddin əl-Musəvi, "əl-Muracəat", səh: 214;

[433] İbn Şəhriaşub, "Mutəşəbihul-Quran va Muxtələfuhu", 2/31;

[434] əs-Subhani, "əl-Aqidə əl-İsləmiyyə", səh: 188-189;

[435] İməduddin ət-Tabrasi, "Əsrarul-İmamə", səh: 252;

qaldığı fərz olunarsa ondan sonra xəlifəsi olacaqdı, Əli də bunun kimidir.[436]

İstisnanı dəlil gətirib Harunun Musaya nisbətdə xüsusiyyətlərinin hamısını Əli haqqında isbat edənlər Harunun ən aşkar xüsusiyyətində, yəni doğma qardaşlıq xüsusiyyətini diqqətə almamaq və onu düşürmək üçün iki yola baş burublar: Bunlardan birincisi örfü əsas gətirib "doğma qardaşlıq" məqamını bu ümumiliyin içindən çıxararaq yerdə qalan ümumiliyi qorumağa çalışırlar. Çünki qardaşlığı Musaya nisbətdə Harunun sahib olduğu məqamlarından biri kimi qəbul edilməsi – ki, bunun belə olmasında bunda heç bir şübhə yoxdur – onların isbat etməkdə əlləşib vuruşduqları əsasları puça çıxarır. Çünki əgər buradakı istisna ilə digər xüsusiyyətlərin ümumiliyi nəzərdə tutulmuş olsaydı qardaşlığın da daxil olması lazımdır. Qardaşlıq daxil olmadığı üçün burada ümumilik qəsd oluna bilməz. **Burada tətbiq edilən ikinci metod isə,** Harunun məqamlarını xüsusi şəkildə müəyyənləşdirmək və onu yalnız siyasi və dini mövqelərlə məhdudlaşdırmaq, bunun xaricində başqa bir şeyə aid etməməkdir. Bu isə əslində məqamların ümumiliyi iddiası ilə doğru gəlmir.

İmami şiələrin metodunu tətbiq edərək Harun barəsində gəlmiş hər bir xüsusiyyəti sadalasaq doğru bir nəticə alınmayacaq, çünki məlumdur ki, Harun ana və atadan Musanın qardaşı idi, Əli isə Peyğəmbərin bu mənada qardaşı olmayıb, əksinə əmisi oğlu və kürəkənidir. Harun Allahdan vəhy alıb təbliğ edən bir peyğəmbər idi, Əli isə peyğəmbər deyildi, Peyğəmbərin səhabəsi idi. Harun danışıq baxımından Musadan daha fəsahətli idi, necəki Allah təalə buyurur: "(Musa dedi:) Qardaşım Harun dildə məndən daha bəlağətlidir. Onu da, (dediklərimi) təsdiqləyən bir köməkçi kimi mənimlə birlikdə göndər. Mən, həqiqətən də, onların məni yalançı sayacaqlarından qorxuram." [28:34] Halbuki Əli və digər səhabələr dil baxımından Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - daha fəsahətli və bəlağətli olmayıblar, əksinə peyğəmbərimiz bütün ərəblərdən, hətta bütün digər peyğəmbərlərdən daha bəlağətli olub. İstisnanın ümumilik meyarını əsas gətirdikdə bu cür problemlər ortaya çıxdır. Sanki Şeyx Əli Al Muhsin bu problemi görə bildiyi üçün bu ümumilik prinsipini tərk etməli olub və belə buyurub: "Peyğəmbər - salləllahu aleyhi və alihi va səlləm - buyurdu ki, Əli - aleyhissalam - onun yanında Harunun Musa yanındakı məqamındadır. Bu məqam isə Qurani-Kərimdə aydın şəkildə

[436] Əbul-Məcd əl-Hələbi, "İşəratus-Səbq", səh: 53;

bəyan olunmuşdur. Lakin hədisin məqsədi Əli ilə Harun arasında bütün cəhətlərdə tam oxşarlığın olduğunu bildirmək deyil."[437] Beləliklə də bu şiə alimi oxşarlığın bütün cəhətlərdə olmasının hədisdəki murad olmadığını deyir. Şiə alimləri arasındakı bu qarmaqarışıqlıq, məqamlardan hansının murad olmasını təyin etməkdəki ixtilaf istifadə olunan metodun tutarsızlığından xəbər verir.

Burada deyiləcək doğru söz budur ki, Harunun Musaya nisbətdə iki məqamı, iki mərtəbəsi olub. Bunlardan **birincisi** peyğəmbərlikdə şəriklik məqamı, **ikincisi** isə vəzirlik, köməkçi olmaq məqamıdır. Məqamların sayını çoxaltmaq məqsədi ilə şiə alimlərinin sadaladıqları islah etmək, köməkçi olmaq, müstəşarlıq etmək, Musanın yoxluğunda onun xəlifəsi olmaq kimi məqamlar və xüsusiyyətlər əslində qeyd etdiyimiz bu iki məqamdan kənara çıxmır, hətta ikinci məqam bunların hamısını əhatə edir. Çünki bir vəzir, səmimi bir müstəşar olmazsa, dəstəkçi olmazsa, olmadığı təqdirdə onun yerinə keçməzsə vəzir sayıla bilməz. Quran və sünnət Muhəmməddən sonra peyğəmbərliyin olma ehtimalını tamamilə inkar etdiyi üçün burada tək bir məqam qalır; o da vəzirlik məqamıdır. Ona görə də burada əsas verilməli olan sual budur ki, bu vəzirlik məqamı mütləq olaraq bütün zamanlara və yürlərə aiddir yoxsa xüsusilə Tabuk döyüşü əsnasında keçərlidir? Harunun vəzirlik məqamının mahiyyəti nə idi?

Vəzir o kəsdir ki, onun rəyinə və fikrinə etimad edirsən və ehtiyac olduqda onun dəstəyindən yararlanırsan. Bu vəzirlik iki işdə ola bilər; peyğəmbərlikdə vəzirlik və şəriklik, ya da tabeçilik və təslimiyyət vəzirliyi. Birincisi Harunun Musaya vəzir olmasının təbiətidir, ikincisinə isə Asifin Süleymana vəzir olmasını göstərmək olar. Ona görə də Musa Allahdan Harunun ona vəzir olmasını istədikdə bunu ona peyğəmbərlik və risaləti təbliğ etmək işində şərik olması üçün istədi. "Mənə öz ailəmdən bir köməkçi ver, Qardaşım Harunu! Onun sayəsində mənim gücümü artır! Onu işimə ortaq et (ona da peyğəmbərlik ver) ki, Sənə çoxlu təriflər deyək və Səni çox zikr edək. Şübhəsiz ki, Sən bizi görürsən!" [20:29-35] Həmçinin buyurur: "Həqiqətən, Kitabı Musaya Biz verdik və qardaşı Harunu da ona köməkçi (vəzir) etdik. (Onlara): "Ayələrimizi yalan sayan bir tayfanın yanına gedin!"- dedik. Sonra Biz o tayfanı yerli-dibli yox etdik." [25:35-36] Əgər Musa sadəcə olaraq məşvərət və dəstək üçün yanında bir nəfərin olmasını istəsəydi Allahdan bir şey istəmədən qardaşını özünə vəzir götürərdi və ya

[437] Al Muhsin, "Məsail Xiləfiyyə Həra fihə Əhlus-Sunnə", səh: 82;

Allahdan bunun üçün izn istəyərdi. Dövlət başçıları, sultanlar, hətta bəzi peyğəmbərlər bunu ediblər. Lakin Musa - aleyhissələm - xüsusilə peyğəmbərlik və risalətin təbliği işində Harunu özünə şərik etməyi istəyib. Təfsir alimləri bu nöqtəyə diqqət çəkərək deyiblər: "Musanın - əleyhissalam - Allahu təala'dan onun üçün bir vəzir təyin etməsini istəməsinin səbəbi bu idi ki, o (qardaşı Harunun) sadəcə vəzir olmasını yox, lakin həm də peyğəmbərlikdə şərik olmasını istəmişdi. Əgər belə olmasaydı Allahdan soruşmadan da qardaşını vəzir seçə bilərdi."[438] Əgər Harunun Musaya vəzirliyi peyğəmbərlikdə vəzirlik və şəriklik mahiyyətində idisə, o zaman Əlinin Allahın elçisinə - salləllahu aleyhi va səlləm - vəzirliyinin bunun mislində və ya buna yaxın olması Mənzilə hədisinin özündə inkar edilir. Bunu İmam İbnul-Həddəd əl-Məğribi (h. 302) gözəl bir şəkildə təsbit edir və deyir: "Harun hələ Musanın sağlığında bir hüccət idi, Əli isə Peyğəmbərin sağ olduğu zaman hüccət deyildi. Harun (Musaya) şərik idi, məgər Əli də Peyğəmbərə - salləllahu aleyhi va səlləm - peyğəmbərlikdə şərik idimi?! Burada Allahın elçisi - salləllahu aleyhi va səlləm - "Əli mənə nisbətdə Harunun Musaya nisbəti kimidir" dedikdə sadəcə olaraq yaxınlığı, vəzirliyi və vəliliyi qəsd etmişdir."[439] Burada deyiləcək tək bir şey budur ki, hədisdəki bənzətmə bir peyğəmbərin öz yoxluğu halında kimisə qövmünün üzərində əmir təyin etməsindədir; Musa - aleyhissələm - Tur dağına qalxarkən qövmünü Haruna tapşırdığı kimi Peyğəmbər də - aleyhissalətu vassələm - Təbuk döyüşünə gedərkən əhlini və qohumlarını Əliyə tapşırıb. Burada Peyğəmbər Əlini ümməti üzərində özündən sonra xəlifə təyin etməyi qəsd etməmişdir. Bu dediyimizi dəstəkləyən bir neçə önəmli nöqtə var:

**Birinci**: Musa öldükdən sonra onun xəlifəsi olmaq məqamının Harunun məqamlarından biri olduğunu qəbul etmirik, çünki Harun təbliğatda özlüyündə bir peyğəmbər idi və əgər Musadan sonra sağ qalsaydı bu məqamını itirməyəcəkdi. Bu məqam xəlifəlik məqamı deyildir, çünki xəlifəlik məqamı bir peyğəmbərin naibliyi mənasındadır. Amma Harun peyğəmbər müstəqil bir peyğəmbər idi, yəni naib olaraq yox, əsl etibarı ilə bir peyğəmbər idi. Niyabət ilə əsalət arasında qədər və şərəf baxımından fərq var. Məlumdur ki, bu yöndən Əlinin xəlifəliyini isbat etmək doğru gəlmir. Üstəlik Harun peyğəmbər Musa

---

[438] əl-Məvardi, "ən-Nukət val-Uyun", 3/401; İbnul-Cəvzi, "Zədul-Məsir", 3/157; əl-Qurtubi, "əl-Cami li Əhkəm əl-Quran", 11/193;

[439] Əbu Bəkr əl-Məliki, "Riyadun-Nufus", 2/85; əz-Zəhəbi, "Siyər Aləm ən-Nubələ", 14/210;

sağ ikən onun yoxluğunda İsrail oğulları üzərində bir xəlifə idi və Musa öldükdən sonra Yuşa bin Nun onun xəlifəsi oldu. Bu onu tələb edir ki, Əli Peyğəmbər - salləllahu aleyhi va səlləm - öldükdən sonra yox, sağ ikən onun yoxluğunda xəlifəsi olub. Bənzərliyin tam yerinə oturması üçün Əlidən başqasının Peyğəmbərin xəlifəsi olması lazımdır, əks təqdirdə Peyğəmbərin etdiyi bənzətmədə - Allah qorusun! - bir qüsur olduğunu deməliyik.[440]

Məşhur mötəzili alimi Əbu Osman əl-Cahiz (h. 255) bununla bağlı maraqlı bir müzakirəyə yer verir: "Hər halda Harunun Musaya olan vəzirliyi iki məqama dayanmalıdır: Ya Musa bir imamın (kimisə) özünə vəzir götürdüyü və ya padşahın özünə vəzir seçdiyi kimi onu öz vəziri təyin etmişdir. Bu isə seçki, layiq görmə və güvən əsasında baş verər. Yaxud da Hərunun Musanın vəziri olması burada qarşılıqlı köməkləşmək, bir-birinin yükünü yüngülləşdirmək və onunla birlikdə çalışmaq mənasındadır. Yəni, onların hər biri digərinin vəziri, köməkçisi və dəstəkçisi idi. Əgər biri qövmündən uzaq düşsəydi, digəri onun yerinə keçərdi. Yoxsa bu məqamı ona verən Musa deyildi. Hərunun Musaya olan mövqeyi, xilafət və vəzirlik baxımından bu iki məqamdan başqa bir şey ola bilməz. Çünki Hərunun peyğəmbərliyi Musa tərəfdən verilməyib və peyğəmbərlik yalnız Allah tərəfindən verilir.Bundan əlavə, Musanın Haruna "Mənim qövmüm arasında mənim yerimə keç" deməsi iki məqama aid edilə bilər: Ya Musa onu öz yerinə keçmək üçün seçmiş, onu buna layiq görmüş və ona güvənmişdir. Yaxud da onların hər biri, digəri qövmündən uzaq olduğu zaman onun yerinə keçən şəxs olmuşdur. Əgər Harunun Musaya olan vəzirliyi və xilafəti Musanın ona bəxş etdiyi iki məqam idisə və Harunun Musaya bundan başqa bir məqamı yox idisə, o zaman Peyğəmbərin - salləllahu aleyhi və səlləm - "Sən mənim üçün Musanın Harun üçün olduğu kimisən" deməsi sanki belə deməkdir: "Sən mənim xəlifəmsən və vəzirimsən". Əgər belədirsə, onda necə deyə bilər ki: "Lakin məndən sonra peyğəmbər yoxdur", halbuki peyğəmbərlik Allah tərəfindən Haruna verilmiş bir məqamdır və Harunun Musadan aldığı bir məqam deyildir. Əgər belədirsə, hikmət sahibi və doğru yol göstərən şəxs (yəni Peyğəmbər) necə bir şeyi onun cinsindən olmayan bir şeydən istisna edə bilər? Bir şeyin bir hissəsi onun bütövündən ayrı ola bilərmi? Necə deyə bilər ki: "Mən səni özüm üçün xəlifə və vəzir etdim, ancaq səni peyğəmbər etmədim", halbuki xəlifə və vəzir təyini onun haqqı olduğu halda peyğəmbərlik onun ixtiyarında deyildi! Belə

---

[440] əl-Alusi, "Muxtəsar ət-Tuhfə əl-İsnə əl-Aşəriyyə", səh: 163-164;

isə, onun "Sən mənim üçün Musanın Hərun üçün olduğu kimisən" deməsi ilə qəsd etdiyi məna budur ki, "Musa Haruna nə verə bilərdisə mənim də sənə verəcəyim odur" və bu məqam isə xəlifəlik və vəzirlikdir. O halda "lakin məndən sonra peyğəmbər yoxdur" sözünü deyərək nə sahib olduğu, nə də sahib ola biləcəyi bir şeyi sahib olduğu, özündən mərtəbə cəhətdən aşağı olan xəlifələrinin belə sahib ola biləcəyi bir şeydən necə istisna edə bilər?! Yaxud da Harunun Musanın vəziri olması onunla birlikdə yardımlaşmaq və bir-birinə kömək etmək məqsədilə olmuşdur və hər biri digərinin vəziri və onun yoxluğunda xəlifəsi olmuşdur. Belə olduqda, Hərunun Musadan vəzirlik və xilafət baxımından aldığı elə bir məqam yoxdur ki, Musanın da Hərundan aldığı eyni məqam olmasın. Əgər belədirsə, o zaman onların xilafəti və vəzirliyi peyğəmbərlikləri və rasulluqları kimi olmuşdur. Əgər belədirsə, o zaman Peyğəmbərin - salləllahu aleyhi və səlləm - Əliyə "Sən mənim üçün Musanın Hərun üçün olduğu kimisən" deməsi necə mümkün ola bilər, halbuki Hərunun Musadan aldığı məqam, Musanın da Hərundan aldığı eyni məqam olub?! Necə ola bilər ki, Peyğəmbər - salləllahu aleyhi və səlləm - bunu Əliyə desin, halbuki Hərunun Musadan aldığı məqam peyğəmbərin peyğəmbərdən aldığı bir məqamdır, yəni bənzər öz bənzərindən, oxşar öz oxşarından bir məqam alır və bu, Allahdan gələn bir məqamdır, eynilə Musanın peyğəmbərliyinin Allahdan olması kimi? Necə deyə bilər ki: "Lakin məndən sonra peyğəmbər yoxdur", halbuki peyğəmbərlik məqamı, qarşılıqlı yardımlaşma və bir-birini dəstəkləmək mənasında Hərunun Musaya nisbətdə sahib olduğu məqamdır."[441]

əl-Cahiz'in sözlərini açıqlamdan əvvəl qeyd edək ki, burda "xəlifəlik" deyildikdə dövlətin başında duran ən ali məqam qəsd olunmur, sadəcə olaraq bir kimsənin yoxluğunda onu əvəz etmək, onun yerinə keçmək nəzərdə tutulur. Ərəbcə buna "istixləf" deyirlər və hətta fiqh kitablarında namazda imam duran kəs öz yerindən ayrılmaq istədikdə yerinə başqasını keçirirsə buna "istixləf" deyilir, yəni yerinə "xəlifəni" qoyursan. əl-Cahiz'in sözlərinə gəldikdə isə o, məsələni burada iki yerə ayırır və qeyd edir ki, Harunun Musaya məqamı ya Musanın ona bəxş etdiyi məqamdır, ya da Allahın bəxş etdiyi məqamdır. Birinci mənadırsa o zaman bu, hər imamın, hər dövlət başçısının, hətta qəbilə başçısının özü üçün seçdiyi xəlifəlik və vəzirlik məqamıdır. Yenə də xatırladaq ki, "xəlifəlik" deyildikdə rəhbərin

---

[441] əl-Cahiz, "əl-Usməniyyə", səh: 156-158;

yoxluğunda onu əvəz etmək mənası qəsd olunur. əl-Cahiz deyir ki, o zaman burada peyğəmbərliyi istisnat etmək onu öz cinsindən olmayan şeylərin içindən istisna etməkdir, çünki peyğəmbərlik məqamını verən Allahdır. Yox əgər ikinci mənadırsa, yəni Harunun vəzirliyi və peyğəmbərliyə şərikliyi Allahın bəxş etdiyi məqamdırsa o zaman buradakı vəzirlik və xəlifəlik Haruna aid olduğu kimi Musaya da aiddir, yəni Musanın yoxluğunda Harun onu əvəz edir, onun xəlifəsi olduğu kimi, Harunun yoxluğunda da Musa onu əvəz edir və onun xəlifəsi olur. Bu baxımdan - əl-Cahiz'ə görə - Peyğəmbərin bunu qəsd etməsi mümkün deyildir, çünki bu, Əlinin Peyğəmbərlə məqamda bərabər olmağını tələb edir, bu isə batildir. Ona görə də buradakı bənzərlik - yuxarıda dediyimiz kimi - Musanın dağa gedərkən Harunu öz qövmü üzərində məsul şəxs kimi tərk etməsindən başqa bir şey olmamalıdır.

**İkinci**: Heç kim ixtilaf etməyib ki, Harun heç zaman Musanın - aleyhiməssələm - xəlifəsi olmayıb, əksinə hələ Musa sağ ikən vəfat edib. Musa öldükdən sonra onun xəlifəsi Yuşa bin Nun - aleyhissələm - olub. Əgər Peyğəmbər - salləllahu aleyhi va səlləm - "sənin mənə nisbətdə mərtəbən Harunun Musaya nisbəti kimidir" deməklə özündən sonra xəlifəsinin kim olduğunu təyin etmək istəmişdisə o zaman belə deməsi daha doğru olardı: "Sənin mənə nisbətdə mərtəbən Yuşanın Musaya nisbəti kimidir." Əgər bunu deməyibsə anlaşılır ki, bununla ölümündən sonra xəlifə təyin etməyi qəsd etməmişdir. Sadəcə olaraq sağ ikən ailəsindən uzaqda olduqda Əlinin Peyğəmbərin ailəsi üzərindəki xəlifəsi olduğunu qəsd etmişdir, necəki Musa Rəbbi ilə görüşə getdikdə Harun onun qövmü üzərindəki xəlifəsi olmuşdu. Bu yöndə əl-Cahiz deyir: "O halda, necə mümkündür ki, Peyğəmbər – salləllahu aleyhi və səlləm – Əliyə "Sən mənim üçün Musanın Harun üçün olduğu kimisən" desin və bununla xilafəti nəzərdə tutsun, halbuki Harun Musa vəfat etdikdən sonra onun xəlifəsi olmamışdır və Peyğəmbərin – salləllahu aleyhi və səlləm - sağlığında da xəlifə təyin edilməmişdir? Əgər belədirsə, hansı məqamda və hansı şərtlər altında Əli xəlifə olacaq, əgər Peyğəmbər onu sağlığında xəlifə təyin etməmişdirsə? Əksinə, necə ola bilər ki, onu özü üçün Musanın aərun üçün olduğu kimi təyin etsin və bununla ondan sonrakı xilafəti nəzərdə tutsun, halbuki Harun Musadan sonra onun xəlifəsi olmamışdır?! Sizin (ey şiələr) bu hədisi verdiyiniz yöntəmsiz izahınız və dəlilinizdəki ziddiyyətiniz iki yoldan birini qaçılmaz edir: Ya hədis batildir və Peyğəmbər – salləllahu aleyhi və səlləm – bunu söyləməmişdir, ya da hədis doğrudur və mənası sizin dediyiniz kimi deyil, təfsiri isə sizin iddia

etdiyiniz şəkildə deyil. Əgər Peyğəmbər – salləllahu aleyhi və səlləm – Əlini özündən sonra xəlifə etmək istəsəydi, halbuki onu sağlığında xəlifə təyin etməmişdir, o zaman belə deyərdi: "Sən mənim üçün Yuşa bin Nun kimisən, lakin məndən sonra peyğəmbər yoxdur." Çünki Yuşa Musadan sonra İsrail oğullarına xəlifə olmuşdur və Musanın sağlığında da, vəfatından sonra da peyğəmbər idi."[442] əl-Qurtubi də eyni nöqtəyə toxunaraq deyir: "Amma ikinci hədisə gəldikdə, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - burada Harunun Musadan sonra xəlifə olmasını nəzərdə tutmadığına dair heç bir ixtilaf yoxdur. Həmçinin Harunun Musadan əvvəl vəfat etdiyi və Musadan - əleyhissələm - sonra onun xəlifəsi olmadığına dair də ixtilaf yoxdur. Əksinə, Musadan sonra xəlifə Yuşə bin Nun idi. Əgər Peyğəmbər - salləllahu aleyhi va səlləm - "Sən mənim üçün Hərunun Musa üçün olan məqamındasan" sözləri ilə xilafəti qəsd etsəydi, "Sən mənim üçün Yuşənin Musa üçün olan məqamındasan" deyərdi. Lakin bunu demədiyinə görə, bu ifadə ilə xilafəti nəzərdə tutmadığı aydın olur. Əksinə, məqsədi o idi ki, "Mən səni həyatda olduğum müddətdə və ailəmdən uzaqda olduğum zaman ailəmə xəlifə təyin etmişəm, necə ki, Musa - əleyhissələm - Rəbbi ilə danışmaq üçün gedərkən Harun öz qövmünə xəlifə olmuşdu"[443] Fətəhi şiələrinə cavab verərkən görkəmli şiə alimi İbn Qibə ər-Razi necə də gözəl və haqlı olaraq bu məsələni bəyan edir və deyir: "Amma Fətəhiyyə məzhəbinə gəldikdə, onların batil olması elə açıqdır ki, bunu gizlətmək mümkün deyil. Çünki İsmayıl Əbu Abdullahdan - aleyhissələm - əvvəl vəfat etmişdir. Halbuki ölmüş bir kəs diri olanın xəlifəsi ola bilməz, əksinə, diri olan ölənə xəlifə olur. Lakin bu qövm öz rəhbərlərinə kor-koranə tabe olub, dəlildən və onun gətirdiyi hökmdən üz çevirdilər. Bu isə elə aşkar bir batillikdir ki, onun izahı üçün uzun-uzadı sübutlara ehtiyac yoxdur. Çünki onun batil olması açıq şəkildə görünür və tənqidi aşkardır."[444] Eyni məntiqlə deyirik ki, Peyğəmbər - aleyhissalətu vassələm - özündən sonra xəlifə təyin etməyi qəsd edirdisə Musanın vəfatından təxminən qırx il əvvəl ölmüş[445] Harunu niyə misal versin ki, halbuki bunun üçün daha gözəl misal Yuşa bin Nun ola bilərdi!? Belə bir şeyi Allahın elçisinə - aleyhissalətu vassələm - nisbət etmək əslində onun nəzərində tutduğu mənanı ifadə etməkdə qüsurlu davrandığını iddia etməkdir. Hətta şiə alimləri özləri

---

[442] Eyni mənbə, səh: 155-156;

[443] əl-Qurtubi, "əl-Cami li Əhkəm əl-Quran", 1/267-268;

[444] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", 1/102

[445] ən-Nəvəvi, "Şərh Sahih Muslim", 15/174;

də qeyd edirlər ki, Əlinin bənzərliyi məhz Yuşa bin Nun ilədir. Murtəda əl-Askəri yazır: "Peyğəmbərlərin sonuncusunun vasisi ilə Musanın - aleyhissələm - vasisi arasında olan oxşarlıq budur ki, Yuşə ibn Nun Musa ilə birlikdə Sina dağında idi və heç vaxt buzova ibadət etmədi. Allah, Peyğəmbəri Musaya - aleyhissələm - ona özündən sonra vəsi təyin etməyi əmr etdi ki, Rəbbin camaatı çobansız qoyulmuş qoyunlar kimi olmasın. Eyni şəkildə, İmam Əli Peyğəmbərlə birlikdə Hira mağarasında idi və heç vaxt bütə ibadət etməmişdi. Allah, Peyğəmbərinə Vəda həccindən qayıdarkən, onu həcilərin qarşısında ümmətin özündən sonrakı rəhbəri kimi təyin etməyi əmr etdi ki, ümmətini başsız qoymasın…"[446] İbn Şəriəşub (h. 588) deyir ki, "Musanın fətası Yuşə idi, Muhəmmədin fətası isə Əli idi…"[447]

**Üçüncüsü:** Həyatda xəlifə (vəkil) təyin etmək bir növ nümayəndəlikdir və hər rəhbər üçün zəruridir. Bu, qəribə bir şey deyil. Həyatda xəlifə təyin etmək ölüm sonrası xəlifə təyin etməyə bənzəmir. Çünki bir insan həyatda olarkən övladları üçün birini xəlifə təyin etsə, bu təyin olunmuş şəxs yalnız tapşırıldığı işlərdə vəkil və təmsilçi olaraq hərəkət edər. Əgər insan övladları üçün ölümündən sonra birini xəlifə təyin edərsə, artıq o, müstəqil bir vəli (idarəçi) olur və işini Allah və Rasulu'nun əmr etdiyi kimi ümumi məsləhətə uyğun yerinə yetirir. Belə biri, vəfat etmiş bir adamın sadəcə vəkili deyil. Eyni qayda ilə, bir şəxs həyatda olarkən başqasını müəyyən işlərdə öz yerinə təyin edərsə, həmin şəxs onun əmrlərinə uyğun hərəkət edər. Lakin, o şəxs vəfat etdikdən sonra xəlifə olaraq təyin edilən şəxs artıq öz səlahiyyəti çərçivəsində müstəqil şəkildə qərar verər. Çünki bu səlahiyyət ona vəfat etmiş şəxsin iradəsinə tabe olaraq deyil, artıq yeni bir hüquqi status kimi verilir. Halbuki ölən adamın etdiyi işlər ona aid edilir və başqasına aid edilməz. Bu səbəblə, heç bir ağıllı insan "bir şəxsin bəzi işlərdə nümayəndə (xəlifə) təyin edilməsi" ilə "ölümündən sonra mütləq xəlifə olması"nın eyni şey olduğunu söyləməz.[448]

**Dördüncü**: Peyğəmbər - salləllahu aleyhi və səlləm - sağ ikən və yoxluğunda, Mədinə və ya digər şəhərdə xəlifə təyin etməkdə Əlini xüsusiləşdirməyib ki, səhabələrdən başqalarının yox, məhz Əlinin onun xəlifəsi olduğunu deyə bilək.. Əksinə, Peyğəmbərin - salləllahu aleyhi

---

[446] əl-Askəri, "Məalimul-Mədrasəteyn", 1/214;

[447] İbn Şəhriəşub, "Mənaqib Al Əbi Talib", 3/45;

[448] İbn Teymiyyə, "Minhəcus-Sunnətin-Nəbəviyyə", 7/339-341; Həmçinin bax: "Təfsir əl-Qurtubi", 7/277;

və səlləm - bütün səfərlərində səhabələrdən birini Mədinəyə vəkil olaraq təyin etdiyi sabit bir məsələdir və tarixi faktdır. Onun Təbuk səfərində Mədinədə Əlini - aleyhissələm - yerinə qoyması, daha əvvəl başqalarını eyni məqama təyin etməyindən daha böyük bir şey deyildi. Çünki Peyğəmbər - salləllahu aleyhi və səlləm - Məkkənin fəthindən sonra - və orada yenicə İslama girmiş bir şəhər olduğu halda, şəhərlərin anası və müsəlmanların qibləsi olduğu halda - ora əməvilərdən olan Attəb bin Əsid bin Əbil-İs'i xəlifə təyin etdi. Peyğəmbər - salləllahu aleyhi və səlləm - bunu Məkkədən çıxıb hərbi səfər üçün Həvazinə gedərkən etdi və vəfat etdikdə Attəb hələ də Məkkə'də təyinatı üzərində qalmışdı. Təbuk səfərindən sonra Vəda həcci zamanı Allahın elçisi - salləllahu aleyhi va səlləm - Mədinə şəhərinə öz xəlifəsi olaraq İbn Ummi Məktum'un təyin etmişdi və bu o deməkdir ki, Əli - kərramallahu vachəhu - artıq Peyğəmbərin Mədinədəki xəlifəsi və vəkili deyildir, əks təqdirdə İbn Ummi Məktumu ora təyin etməsi keçərli olmazdı. Əgər iddia olunduğu kimi xəlifə təyini əzl olunmayana qədər öz keçərliliyini qoruyub saxlayırsa o zaman İbn Ummi Məktum buna daha layiqli olmalıdır, çünki Mədinəyə ən son xəlifə təyin olunmuş şəxs o idi. Yekun olaraq deməliyik ki, Mədinəyə xəlifə və əmir olaraq təyin olunmaq Əliyə - radiyallahu anhu - özəl olan bir xüsusiyyət deyildir, digər səhabələr də eyni məqama təyin olunmuşdular, hətta onlardan bəziləri bu məqama daha çox seçilmişdilər. Ona görə də bu təyinat özlüyündə kiminsə əfzəl olmağına dəlalət etmir. Əgər Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əlini Mədinədə xəlifə təyin edərkən bununla özündən sonrakı əmirliyi və xilafəti qəsd edirdisə və əgər həqiqətən də Əli peyğəmbərlikdən başqa bütün məqamlarda Harunla eynidirsə o zaman necə olur ki, eyni ildə Təbuk döyüşündən sonra həccə əmir olaraq onu yox Əbu Bəkri təyin etdi, üstəlik Əlini bəraət ayəsi ilə göndərərkən onu Əbu Bəkrin əmirliyinə tabe tutdu?!

**Beşinci**: Ordu başına əmir təyin olunmaq məsələsində heç bir səhabə, nə Əli, nə Əbu Bəkr, nə Ömər, nə də qeyriləri Zeyd bin Hərisə ilə - radiyallahu anhum əcməin - müqayisə oluna bilməz. Hətta şəhid edildikdən sonra oğlu Usəmə'ni içində ən əfzəl səhabələrin olduğu bir orduya əmir təyin etdi. Aişə anamız Peyğəmbərin - salləllahu aleyhi va səlləm - hətta öz atası Əbu Bəkrə vermədiyi bu məqamla bağlı Zeydi necə xüsusiləşdirdiyini görərək deyir: "Elə bir qoşun yox idi ki, Peyğəmbər - salləllahu aleyhi və səlləm - Zeyd bin Harisəni orada göndərdikdə, onu onların başçısı təyin etməsin. Əgər o, Peyğəmbərdən - salləllahu aleyhi və səlləm - sonra sağ qalsaydı, onu

öz xəlifəsi təyin edərdi.”[449] Əbu İshaq əs-Səbii deyir: “Allahın elçisi - salləllahu aleyhi va səlləm - Zeyd bin Hərisə’ni göndərdiyi elə bir səriyyə olmadı ki, ona əmir olmasın.”[450] Sələmə bin əl-Əkva deyir: “Mən Peyğəmbər - salləllahu aleyhi və səlləm - ilə yeddi döyüşdə iştirak etdim, Zeyd bin Harisə ilə isə doqquz döyüşdə oldum. Onu Peyğəmbər - salləllahu aleyhi və səlləm - başımıza əmir təyin edirdi.”[451] Bununla da aydın olur ki, şəhərə vali və ya orduya əmir təyin etmək Əlinin - kərraməllahu vachəhu - məziyyətlərindən deyildi və belə bir təyinat ümumiyyətlə özündən sonra xəlifə təyin etmək hökmündə ola bilməz.

**Altıncı:** Hədisdə gətirilən əsas dəlil budur ki, istisna ümumiliyin meyarıdır. Lakin bu iddia yalnız “muttasil istisna” üçün keçərlidir. “Munqati istisna” ümumiliyin meyarı sayılmaz. Üsul və ərəb dili alimi Saduddin ət-Təftəzəni deyir: “Qeyd edilən istisna, 'nübüvvət istisna olmaqla' ifadəsində olduğu kimi, məqamlardan bəzi fərdlərin çıxarılması mənasını daşımır. Əksinə, bu, ərəb dilində aydın olduğu kimi, 'lakin' (لكن) mənasını verən münqəti istisnadır. Buna görə də ümumiliyi ifadə etmir. Necə ki, onun (yəni Harunun) məqamlarından biri nəsəb qardaşlığıdır və bu, Əli haqqında sabit olmayıb.”[452] Burdakı istisnanın munqati olduğunu biz yuxarıda əl-Cahiz’in dediklərindən də başa düşürük, çünki peyğəmbərlik məqamı öz cinsindən istisna olunmamışdır. Peyğəmbərlik məqamı Allahın bəxş etdiyi bir məqamdır, Harunun Musaya nisbətdə tutduğu məqamlar isə tamamilə fərqli cinsdəndir. Bu məqamlardan biri budur ki, Harun Musadan dildə daha fəsahətli olduğu üçün xitab etməkdə hər ikisinin adından danışardı. Harun yaşda ondan böyük idi, onun doğma qardaşı idi. Sağlığında da peyğəmbərlikdə Musaya şərik idi. Əgər burdakı istisnanın muttasil növdən olduğunu desək və təbii ki, bu növün ümumiliyin meyarı olduğunu söyləsək qəbul etməliyik ki, Əli Peyğəmbər sağ ikən peyğəmbərliyində onun şəriki idi, Əli peyğəmbərdən daha fəsahətli idi, Əli onun doğma qardaşı idi. Əgər bu

[449] İbn Sad, “ət-Tabəqat əl-Kubra”, 3/46 (Dar Sadir); İbn Əbi Şeybə, “əl-Musannəf”, 6/392 və 7/415 (Hut çapı); “Musnəd Əhməd”, 43/74 və 252; Şeyx Şueyb deyir: “İsnadı - əgər əl-Bəhinin, yəni Abdullahın Aişədən eşitdiyi sabitdirsə - həsəndir. Buxari bunu (yəni eşitdiyini) "**ət-Tarix əl-Kəbir**" (5/256)-də təsdiqləyib, lakin İmam Əhməd bunu inkar edir.”

[450] Bunu Abdillah bin Əhməd “Fədailus-Sahabə” kitabında (1528) rəvayət edir və isnadı səhihdir.

[451] “əl-İhsən fi Təqrib Sahih İbn Hibban”, 16/139 (7174); İsnadı səhihdir.

[452] ət-Təftəzani, “Şərhul-Məqasid”, 3/505; Darul-Kutubil-İlmiyyə

məqamların heç birini qəbul etmiriksə etiraf etməliyik ki, buradakı istisna munqati növdəndir və “lakin” mənasını verir.

Burada Fəxruddn ər-Razi’nin nəzərindən qaçmamış incə bir məqam var ki, çoxları bu incəlik üzərində düşünmürlər. ər-Razi deyir: “Bil ki, yaxşılığa çağırmaq və müsəlmanlara şəfqət göstərmək vacibdir. Sonra, Harun - aleyhissələm - qövmünün cəhənnəmə tərəf sürətlə getdiyini gördükdə onların çoxluğuna və gücünə məhəl qoymadı, əksinə haqqı açıq şəkildə bəyan etdi və dedi: "Ey qövmüm! Siz bununla ancaq sınağa çəkildiniz..." [20:90]. Burada incə bir məqam var: rafizilər Peyğəmbərin - salləllahu aleyhi və səlləm - Əliyə dediyi "Sən mənim üçün Harunun Musaya olan məqamındasan" sözünə istinad edirlər. Halbuki Haruna - aleyhissələm - belə bir izdihamda təqiyyə mane olmadı: o, minbərə çıxdı, haqqı açıq şəkildə bəyan etdi, insanları özünə tabe olmağa və başqasına tabe olmaqdan çəkinməyə çağırdı. Əgər Muhəmmədin - salləllahu aleyhi və səlləm - ümməti yanlış yolda olsaydı, Əlinin də Harunun - aleyhissələm - etdiyi kimi etməsi, qorxmadan və təqiyyə etmədən minbərə çıxıb: "Mənə tabe olun və əmrimə itaət edin" deməsi lazım gələrdi. Lakin bunu etmədiyinə görə bildik ki, ümmət doğru yolda idi.”[453] Nəticə çox aydındır, beləki əgər Allahın elçisi - salləllahu aleyhi va səlləm - Əlini Haruna bənzətməklə ona özündən sonra ümmətin rəhbəri vəzifəsini verməyi qəsd etmişdisə, o zaman deməyimiz lazımdır ki, Əli o vəzifəsində Harunun davrandığı kimi davranmayıb.

əl-Alusi deyir: “Biz xilafətin Musanın ölümündən sonra Harunun rütbələrindən bir rütbə olacağını qəbul etmirik, çünki o, müstəqil bir peyğəmbər idi və əgər yaşasaydı o cür qalacaqdı. Peyğəmbərlik dərəcəsi ilə xilafət arasında heç bir yaxınlıq yoxdur…”[454] Burada qeyd etmək lazımdır ki, Musa öldükdən sonra Harun - sağ qaldığı təqdirdə - xəlifə olacaqdısa bu da yenə onun peyğəmbər olmasına görə olacaqdı, yoxsa Harunun ayrılıqda imamlıq, xəlifəlik rütbəsi yox idi və bunu iddia etmək üçün dəlil lazımdır. Harun müstəqil bir peyğəmbər kimi tabe olunmağa layiq olduğu üçün insanlar ona tabe olmalı idilər və Harun ölməsəydi, Musadan sonra yaşasaydı peyğəmbər olduğu üçün insanlar ona tabe olacaqdılar. Bunu başqa cür belə ifadə etmək olar; əgər Harun sadəcə bir vəzir və köməkçi olsaydı Musanın vəfatından sonra onun imam və xəlifə olmasını vacib qılacaq heç bir əqli və ya şəri bir

---

[453] “Təfsirur-Razi”, 22/91;

[454] əl-Alusi, “ən-Nəfəhət əl-Qudsiyyə”, səh: 86;

səbəb yoxdur, bunun üçün xüsusi təyinatın olması lazım gələcəkdi. Eyni şəkildə Əli bin Əbi Talib'də peyğəmbərlik vəsfi olmadığı üçün bu mənada sonuncu peyğəmbərdən sonra xəlifə olması da gərəkməz.

## Sonuncu Peyğəmbər

Biz həmçinin imamlar və onların fəzilətləri haqqında şiə kitablarında varid olmuş xəbərlər üzərində düşündükdə, sonra Allahın Muhəmmədi - salləllahu aleyhi va səlləm - peyğəmbərlərin sonuncusu qılması ilə bunu müqayisə etdikdə ortaya ciddi suallar çıxır. Şiə kitablarına inanmalı olsaq on iki imam "Allahın qapıları, Ona aparan yollardır"[455], "Rəbbin hicablarıdır, Onunla yaratdıqları arasındakı vasitələrdir"[456], "insanlar yalnız və yalnız onlarla hidayət taparlar, onlar Allahla insanlar arasındakı vəsilələrdir və Cənnətə yalnız onları tanıyanlar daxil olacaqlar"[457], "onlar Şəriətin qoruyucuları, onun himayədarlarıdırlar, onların bu işdəki halı bir peyğəmbərin halıdır"[458], "şəriətin ilahi hökmləri yalnız onların bulaqlarından içilər, (bu hökmləri) onlardan başqalarından öyrənmək səhih deyildir"[459], imamlar "mələklərə, peyğəmbərlərə və rasullara verilmiş bütün elmləri bilirlər"[460], "imamlar Allahdan - azzə va cəllə - bir əhd, Ondan bir buyuruq olmadan heç bir şey etməzlər[461]", "mələklər onların evlərinə daxil olurlar, xalılarına ayaq basırlar və onlara xəbərlər gətirirlər"[462], "ölüləri diriltməyə, korları və cüzam xəstələrini sağaltmağa və peyğəmbərin bütün möcüzələrinə qadirdirlər"[463], "cinlər onların xidmətçiləridir, onlara görünürlər və dini

[455] əl-Muzaffər, "Aqaid əl-İməmiyyə", səh: 69;
[456] əl-Məclisi, "Bihər əl-Ənvar", 23/97
[457] Eyni mənbə, 23/99;
[458] əl-Muzaffər, "Aqaid əl-İməmiyyə", səh: 67;
[459] Eyni mənbə
[460] əl-Kuleyni, "əl-Kəfi", 1/255;
[461] Eyni mənbə, 1/279;
[462] Eyni mənbə, 1/393;
[463] əl-Məclisi, "Bihər əl-Ənvar", 27/29;

təlimləri onlardan soruşurlar”[464], “Allahın qatından endirilmiş bütün kitablar onların yanında var və dillərinin fərqli olmasına baxmayaraq bu kitabların hamısını bilirlər”.[465] İmamlar haqqında şiə kitablarındakı vəsflər o qədər mübaliğəli, o qədər əhatəlidir ki, şiə alimlərinin bu vəsfləri İslam şəriətinin qəti nasları ilə uzlaşdırmaq cəhdlərinə təəccüblənməmək mümkün deyildir. əl-Kuleyni “əl-Kəfi” kitabında açdığı bir başlığın altında Allahın imamlara dəstək olaraq göndərdiyi “Ruh” haqqında danışır. Bu başlıqda gətirdiyi hədisdə Əbu Bəsir deyir: “Əbu Abdilləhdən - aleyhissələm - Allahın - təbərakə va təalə - bu ayəsi haqqında soruşdum: “Biz sənə Öz əmrimizdən olan Ruhu vəhy etdik. Sən kitab nədir, iman nədir bilmirdin.” [42:52] Dedi: “(Ruh) Allahın - azzə va cəllə - yaratdığı məxluqlardan bir məxluqdur ki, Cibril və Mikail’dən də əzəmətlidir. Allahın elçisi ilə - salləllahu aleyhi va əlihi - bir yerdə idi, ona xəbər verərdi, onu dəstəkləyərdi və o, ondan sonra imamların yanındadır.”[466] Bu, əl-Kuleyni’nin həmin başlıqda gətirdiyi birinci hədisdir, həmin başlıq altında gətirdiyi üçüncü və dördüncü hədislər də ləfz olaraq birinci ilə o qədər bənzərdir ki, bunların əslində bir hədis olduğunu deyə bilərik. əl-Məclisi birinci və üçüncü hədislərin səhih, dördüncünün isə həsən olduğunu deyir.[467] Beləliklə də Allahın elçisinə kitabın və imanın nə olduğunu öyrədən, Cibril və Mikail kimi mələklərdən də əzəmətli olan bir məxluq, imamların yanında olub, onlara dəstək verib. əl-Kuleyni kitabında açdığı bir başqa başlıqda isnadı ilə belə bir rəvayətə yer verir: “Ammar əs-Səbəti dedi: “Əbu Abdilləhə - aleyhissələm - soruşdum: “Hökm verdiyinizdə nə ilə hökm verirsiz?” Dedi: “Allahın hökmü və Davudun hökmü ilə! Əgər haqqında biliyimiz olmayan bir şey soruşulsa onu bizə Müqəddəs Ruh öyrədər.”[468] Şiə şeyxlərindən Xalil Rizq bu mənada olan rəvayətləri gətirdikdən sonra yazır: “Bu rəvayətlər bəyan edir ki, məhz Müqəddəs Ruhun sayəsində imamlar - aleyhimussələm - Ərşin altındakılardan tutmuş Yerin altındakılara qədər hər şeyi biliblər, məhz onun vasitəsilə işlərin həqiqətini biliblər, onun vasitəsilə Allahın hökmü və peyğəmbərlərin hökmü ilə hökm edə biliblər.”[469] əl-Məzəndərani bu ruh haqqında məlumat verərkən deyir: “Qeybin qanunlarının və

[464] əl-Məclisi, “Bihər əl-Ənvar”, 27/13-24; əl-Kuleyni, “əl-Kəfi”, 1/394;

[465] əl-Kuleyni, “əl-Kəfi”, 1/227;

[466] əl-Kuleyni, “əl-Kəfi”, 1/273

[467] əl-Məclisi, “Mirətul-Uqul”, 3/169-172;

[468] əl-Kuleyni, “əl-Kəfi”, 1/398; əl-Məclisi “Mirətul-Uqul” kitabında (4/303) isnadının muvassəq olduğunu yazır.

[469] Rizq, “İlmul-Əimmətil-Məsumin”, səh: 99;

mələkutun sirlərinin onda təcəlli etdiyi müqəddəs qüvvə ilə vəsf olunmaq baxımından Müqəddəs Ruh peyğəmbərlərə və imamlara xasdır, onun səbəbi ilə onlar bütün şeylərin həqiqətini bilirlər və onun sayəsində təlim və irşad əhli olurlar. Mühəqqiq alimlərdən birinin dediyi kimi Ruhun, Allahın əvəzsiz əliaçıqlığı və Ondan sadir olan feyz olması da bunu dəstəkləyir: onun bir ruh olması sadəcə olaraq onun bütün feyzin, rahatlığın və həyatın həqiqi mənada başlanğıcı olmasına görədir və o, peyğəmbərlik həqiqətinin əsasını təşkil edən ruhdur."[470] Aydındır ki, peyğəmbərləri peyğəmbər edən Ruh eyni dərəcədə, eyni qüvvədə imamlarda da mövcud olub. Təqdim olunan rəvayətlərdən ortaya çıxan reallıq budur ki, imamlar da peyğəmbərlər kimi vəhy alırlar, aradakı fərq sadəcə vəhy metodundadır. əl-Kuleyni rəvayət edir ki, Zurara deyib: "Əbu Cəfər'dən - aleyhissələm - Allahın - azzə va cəllə - "o, bir rasul, bir peyğəmbər idi" ayəsi haqqında soruşdum; rasul nədir və peyğəmbər nədir?" Dedi: "Peyğəmbər o kəsdir ki, yuxusunda görür, səsi eşidir və mələyi (ayıq ikən) öz gözü ilə görə bilmir. Rasul isə o kəsdir ki, səsi eşidir, yuxuda görür və (ayıq ikən) mələyi öz gözləri ilə görə bilir." Dedim: "Bəs imamın mərtəbəsi nədir?" Dedi: "Səsi eşidir, mələyi isə nə yuxuda, nə də ayıq ikən görə bilir..." Eyni başlıq altında üçüncü hədisdə əl-Əhval deyir: "Əbu Cəfər'dən - aleyhissələm - rasul, peyğəmbər və muhəddəs haqqında soruşdum. Dedi: "Rasul o kəsdir ki, Cibril onun qarşısına çıxır, onu görür, onunla danışır; bax bu, rasuldur. Peyğəmbərə gəldikdə isə İbrahim öz yuxusunda gördüyü kimi, Allahın elçisi vəhydən əvvəl nübuvvətin səbəblərindən olan yuxuları gördüyü kimi... Peyğəmbərlərdən eləsi var ki, onun üçün nübuvvət vəsfləri bir arada toplanıb, yuxuda görür, Ruh onun yanına gəlir, ayıq halda onu görmədən onunla danışır. Muhəddəs isə o kəsdir ki, onunla danışılır və o eşidir, amma (ayıq ikən mələkləri) görmür, yuxuda da görmür."[471] Bəzi rəvayətlərdə isə nəbi (peyğəmbər) ilə imam arasındakı fərq belə qeyd olunur: "Peyğəmbər sözü eşidir, bəzən də şəxsin özünü görür və (görərkən) eşitmir. İmam isə danışılanı eşidir, şəxsi isə görmür."[472] Beləliklə də vəhy metodundakı fərq budur ki, peyğəmbərlər mələkləri görə bilirlər, imamlar isə görə bilmirlər, lakin eşidirlər.

---

470 əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 6/72;

471 əl-Kuleyni, "əl-Kəfi", 1/176; əl-Məclisi "Mirətul-Uqul" kitabında (2/287-289) hər iki hədisin səhih olduğunu yazır.

472 Eyni mənbə

Şeyx əl-Mufid "Əvail əl-Məqalət" kitabında təsdiq edir ki, imamlar mələklərin özlərini görməsə də onların danışıqlarını eşidirlər. Üstəlik yuxularının doğruluğunda imamların rasullar və peyğəmbərlər ilə eyni mərtəbədə olduğunu da təsdiqləyir.[473] əl-Mufid bununla belə vurğulayır ki, peyğəmbərimizdən - salləllahu aleyhi va səlləm - sonra vəhy kəsilib, bu baxımdan imamlara vəhyin gəldiyini demək olmaz. Burada aşkar bir ziddiyyət ortaya çıxır, çünki əl-Mufid də daxil olmaqla şiələrin böyük alimləri təsdiq edirlər ki, imamlar peyğəmbərdən - aleyhissələm - sonra Allahdan birbaşa ilham alıblar və ya mələklərin sözünü eşitmək vasitəsilə Allahdan elm öyrəniblər, lakin əl-Mufid qeyd edir ki, buna vəhy demək olmaz. Mahiyyət baxımından peyğəmbərlərə enən vəhy ilə eyni olsa da şəriət onu bu cür adlandırmağı qadağan edib. əl-Mufid yazır: "Vəhy sözünün əsli "gizli söz" deməkdir. Sonra başqasına yox, məhz muxataba gizlində çatdırılması istənilən, xüsusilə onun üçün nəzərdə tutulmuş hər bir söz üçün də vəhy deyilə bilir. Vəhy sözü Allaha izafə edildikdə İslamın örfündə, peyğəmbərin şəriətində bu vəhy yalnız rasullara xas olan, başqalarını nəzərdə tutmayan vəhy olur. Allahu təalə deyir: "Biz Musanın anasına vəhy etdik ki…" [28:7] Islam əhli ittifaq edib ki, bu vəhy ya Musanın anasının - ona xas olaraq - yuxuda gördüyü bir şey və ya eşitdiyi bir söz olub. Allahu təalə buyurur: "Rəbbin bal arısına belə vəhy etdi…" [16:68] Bununla gizli ilhamı qəsd edir, çünki başqalarına deyil, məhz ayırıb seçdikləri üçün xüsusiləşdirib, beləliklə də Onun arı üçün hasil olan elmi danışanın ucadan səsləndirdiyi, başqalarına da eşitdirdiyi bir kəlam olmayıb. Allahu təalə buyurur: "Həqiqətən, şeytanlar öz dostlarına sizinlə mübarizə aparmalarını vəhy edirlər.." [6:121] Mənası budur ki, (şeytanlar) qulaqlarının dərinliklərinə atdıqları kəlam ilə öz dostlarına vəsvəsə verirlər, beləliklə də öz bildiklərini başqalarına yox, xüsusilə onlara öyrədirlər. Allah subhənəhu deyir: "Beləcə o, mehrabdan öz qövmünün yanına çıxaraq onlara vəhy etdi ki,…" [19:11] Bununla açıqdan bir söz söyləmədən, yalnız işarə ilə başa salmağı qəsd edir. Bunu vəhyə bənzətməsi muxatablardan başqalarından gizli qalmasına, başqalarından örtülü olmasına görə idi. Allah bəzən bir çox kimsəyə yozumu doğru olan, haqq olduğu sabit olan yuxular göstərir, lakin (İslam) şəriət(i) bərqərar olduqdan sonra bu cür hallara vəhy adı verilməz və bizim bu zamanımızda Allahın kiməsə bir şeyin elmini verməsinə "ona vəhy olundu" deyilməz. Bizim etiqadımıza görə Allahu təalə peyğəmbərindən - salləllahu aleyhi va alihi va səlləm - sonra da hüccətlərə (yəni imamlara) gələcəkdə baş

[473] əl-Mufid, "Əvail əl-Məqalət", səh: 69-70;

verəcək şeylərin elmi haqqında sözlər eşitdirir, lakin buna “vəhy” adı verilməz, çünki daha əvvəl də təqdim etdiyimiz kimi müsəlmanlar icma ediblər ki, peyğəmbərimizdən sonra heç bir kimsəyə vəhy gəlməyib və bizim zikr etdiklərimizdən heç biri barəsində onun kiməsə vəhy olduğu söylənilməz. Allahu təalə bəzi vaxtlar bir adın verilməsinə izn verir, bir başqa vaxt isə onu qadağan edə bilir, bəzən bəzi əlamətlərlə vəsf olunmağı qadağan edə bilər, bəzən isə icazə verə bilər. Mənalara gəldikdə isə, onlar heç zaman öz həqiqətlərini dəyişməzlər…”[474] Beləliklə də əl-Mufid burada qəbul edir ki, Allahu - təalə - imamlara bəzi elmləri - məhz onlara xas olaraq - söz olaraq eşitdirə bilir, lakin buna vəhy demək olmaz. Mahiyyət və məna olaraq peyğəmbərlərə verilən vəhy ilə eyni olsa da şəriətimiz “vəhy” sözünü peyğəmbərlər üçün xüsusiləşdirdiyi üçün imamlara münasibətdə “vəhy” sözü işlənməz. əl-Mufid’in sözünün mənası budur. Şiə alimi Bəsim əl-Hilli burada daha dəqiq bir məna olduğuna diqqət çəkir. O deyir: “əl-Mufid peyğəmbərdən sonra əhlul-beytin imamlarına - aleyhimussələm - vəhyin nazil olmasını imkansız hesab edib və onun “vəhy” sözü ilə qəsdi peyğəmbərlik vəhyidir, yəni özündən əvvəlkini nəsx edən şəriət vəhyidir, çünki zəruri olaraq bilirik ki, Muhəmmədin halal etdiyi Qiyamət gününə qədər halaldır, haram etdiyi də belədir. Bu isə mələklərin imamlara dəstək məqsədilə nazil olmaqları faktı ilə ziddiyyət təşkil etmir.” Bəsim əl-Hilli təsdiq edir ki, əl-Mufid imamlara vəhyin endiyini inkar edərkən bununla xüsusi bir növ vəhyi qəsd edib, yəni Muhəmmədin şəriətini nəsx edən vəhyi inkar edib, yoxsa “peyğəmbərin əmr etdiyinə dəstək verən, Quranın söylədiklərinə güc verən mütləq vəhyi qəsd etmir, çünki bunu imkansız edən bir şey yoxdur, əksinə bunu isbat edən xəbərlər mütəvatirdir…”[475] Beləliklə də Bəsim əl-Hilli deyir ki, hər ikisi də vəhydir, lakin imamların vəhyi nəsx edici növdən deyildir. əl-Miqdad əs-Suyuri (h. 826) də təsdiq edir ki, imamlara vəhy gəlir, lakin onlar vəhyi vasitə ilə alırlar, onların aldıqları vəhy birbaşa deyildir, vasitə ilədir. “İmamət nübuvvətin xilafətidir, onun yerinə keçir, (nübuvvətdən) bir tək vasitəsiz olaraq ilahi vəhy almaqda fərqlənir.”[476] Şeyx Muhəmməd Asif Muhsini imamların elmləri haqqında danışarkən bu barədə gəlmiş rəvayətlərin tərkibini otuz bir fərqli növə ayırır. Misal üçün üçüncü növ haqqında deyir: “Onların - aleyhimussələm - peyğəmbərlərin və mələklərin elminə sahib

[474] əl-Mufid, “Təshih İtiqadət əl-İməmiyyə”, səh: 120-122;

[475] Bəsim əl-Hilli, “əl-Cəli fi İsməti Al ən-Nəbi”, səh: 285-286;

[476] əs-Suyuri, “ən-Nəfi Yəuməl-Həşr”, səh: 95;

olduqlarını bildirən xəbərlər. Bu mövzuya dair iyirmi beşdən çox rəvayət mövcuddur." Altıncı növ barəsində deyir: "Onların - aleyhimussələm - peyğəmbərlərdən - aleyhimussələm - daha bilikli olduqlarını açıq şəkildə bildirən xəbərlərdir. Bu mövzuya dair on beşdən çox rəvayət var." Doqquzuncu növ barəsində isə buyurur: "Onların Allahu təalanın elminin xəzinədarları olduqlarını bildirən xəbərlərdir. Bu mövzuya dair on altı rəvayət var." On beşinci növ barəsində buyurur: "Onların insanlar haqqında heç bir şeyin onlardan gizli qalmadığını bildirən xəbərlərdir. Əgər insanlar onlara müraciət etsəydilər, hər bir imam - aleyhissələm - onlara aid olan şeyləri xəbər verərdi. Onların ölüm vaxtlarını (mənaya), fəlakətləri (bəlaya) və nəsəbləri bildiklərini bildirən xəbərlərdir. Bu mövzuya dair otuzdan çox rəvayət var." On səkkizinci növün altında yazır: "Onların keçmişi və qiyamət gününə qədər olacaq hadisələri bildiklərini ifadə edən xəbərlər. Bu barədə yeddi rəvayət var:" Növbəti növün altında isə yazır: "Onların məşriqdən məğribə qədər hər şeyi gördüklərini bildirən və hər şəhərdə onlar üçün bir nur sütununun qaldırıldığını, oradan insanların əməllərinə baxdıqlarını ifadə edən xəbərlər. Bu barədə on dörd rəvayət var." İyirmi birinci növ üçün buyurur: "Onların qulaqlarına pıçıldandığını – bu eşitmədir – və qəlblərinə ilham olunduğunu – bu isə vəhy olunmayan bir şəkildə qəlbə bilik yerləşdirilməsidir – bildirən xəbərlər. Bu, mənaca əvvəlki növə yaxındır, çünki elmin meydana gəlməsi məhz bu pıçıldama və ilham ilə baş verir. Hətta bəzi rəvayətlərdə bu açıq şəkildə ifadə edilmişdir." İyirmi dördüncü növ: "Səhər və axşam onlara səma və yer xəbərlərinin gəldiyini bildirən xəbərlər. Bu barədə altı rəvayət var." İyirmi beşinci növ: Onların istədikləri zaman elm əldə edə bildiklərini ifadə edən xəbərlər. Bu barədə doqquz rəvayət var."[477] Bəzi rəvayətlərdə imamların qeybi bilmədiklərinə dair məlumatlar keçdikdə əl-Məclisi kimi bir şiə alimi buna açıqlıq gətirərək buyurur: "Onlardan qeyb elminin inkar edilməsi ilə qəsd olunan budur ki, onlar bunu vəhy və ilham olmadan bilmirlər. Lakin vəhy və ilham vasitəsilə qeybi bilməklərini inkar etmək olmaz, çünki peyğəmbərlərin və vasilərin - aleyhimussələm - möcüzələrinin əsasını məhz qeyb xəbərləri təşkil edirdi."[478] Qəlbə ilhamın danması, qulağa səsin gəlməsi, mələklərin danışığını eşitmək, yuxuda görmək kimi halların hamısı əslində vəhyin fərqli növləridir. əl-Muhsini bunu belə ifadə edir: "Vəhyin dörd növü vardır: qəlbə ilham olunması,

---

[477] əl-Muhsini, "Siratul-Haqq", 3/284-287

[478] əl-Məclisi, "Bihərul-Ənvar", 25/268;

yuxuda görülməsi, mələk olmadan bir səsin eşidilməsi, mələyin səsinin eşidilməsi – bu isə ya onun müşahidə olunması ilə, ya da müşahidə olunmadan baş verir. İmam Baqirdən - aleyhissələm - nəql olunan bir rəvayətdə deyilir: "Peyğəmbərlər beş növdür: onlardan bəziləri zəncirin səsi kimi bir səs eşidirlər və bununla ondan nə qəsd olunduğunu anlayırlar, bəziləri Yusuf və İbrahim kimi yuxularında xəbər alırlar, bəziləri müşahidə edirlər, bəzilərinin qəlbinə ilham olunur və qulaqlarına yerləşdirilir."[479] əl-Muhsini daha sonra qeyd edir ki, burada qulaqlarına yerləşdirilməsi səsi eşitmək mənasındandır. Əgər peyğəmbərlər öz aralarında bu cür vəhyin fərqli növləri ilə fərqlənirlərsə o zaman bu bir daha sübut edir ki, imamlar ilə peyğəmbərlər arasıda mahiyyət baxımından heç bir fərq yoxdur. İbnul-Meysəm əl-Bəhrani deyir: "İmam Sadiqdən - aleyhissələm - rəvayət olunub ki, o buyurdu: "Əli - aleyhissələm - peyğəmbər - salləllahu aleyhi və alih - in risalətdən əvvəl nuru gördüyünü və səsi eşitdiyini görərdi." Və həmin səhifədə belə deyilir: "Bunu Peyğəmbərin - salləllahu aleyhi və alih - Əlinin - aleyhissələm - soruşduğu zaman verdiyi cavab da təsdiqləyir: 'Şübhəsiz ki, sən mənim eşitdiyimi eşidir, mənim gördüyümü görürsən. Lakin sən peyğəmbər deyilsən.' Beləliklə, Peyğəmbər - salləllahu aleyhi və alih - onun vəhyin eşidilməsinə, mələyin sözlərini və şeytanın səsini eşitmək dərəcəsinə, həmçinin Peyğəmbərin - salləllahu aleyhi və alih - gördüklərini görmək və eşitdiklərini eşitmək məqamına çatdığına şahidlik etmişdir."[480] Mirzə Həbibullah əl-Həşimi əl-Xoyi isə deyir: "Peyğəmbərin - salləllahu aleyhi və alih - "şübhəsiz ki, sən mənim eşitdiyimi eşidir, mənim gördüyümü görürsən" sözlərinə gəlincə, bu ifadənin zahiri göstərir ki, imam mələyin səsini Peyğəmbər kimi eşidir və onu görür. Mələklərin səsini eşitməsi məsələsinə gəldikdə, bunda heç bir şübhə yoxdur və bunu təsdiqləyən çoxlu rəvayətlər vardır. Mələyi görmək məsələsinə gəldikdə isə, buna bəzi rəvayətlər dəlalət edir."[481] Seyyid Abdullah Şubbər qətiyyətlə qeyd edir ki, Əlidə kamillik mərtəbələrindən ikisindən savayı hamısı var idi. O Əliyə nisbət edilən "Mən Rəbbimdən iki yaş kiçiyəm" sözü barədə belə deyir: "Şübhəsiz ki, o - aleyhissələm - (bu sözlərində) özünə müqəddəslik verərək vilayət-i mütləqə (qeydsiz-şərtsiz vilayət) məqamını (özü üçün) isbat etmişdir ki, bu da ilahilik və vacibül-vücud məqamı istisna olmaqla, bütün kamillik mərtəbələrini ehtiva edir. Heç bir şübhə yoxdur ki, o, bu iki

---

[479] əl-Muhsini, "Siratul-Haqq", 3/140;

[480] əl-Bəhrani, "Misbəhus-Salikin", 4/318;

[481] əl-Haşimi, "Minhəcul-Bəraah fi Şərh Nəhc əl-Bələğa", 12/43;

mərtəbədən başqa hər bir mövcudluq və kamillik dərəcəsini özündə cəmləşdirmişdir."[482] Bütün bunlar ona dəlalət edir ki, bu alimlərə görə peyğəmbərlərdə olan bütün mərtəbələr imamlarda da olub.

Burada ortaya çıxan nəticə çox aydındır. İmamlar insanlara Muhəmmədin şəriətində nəyin halal, nəyin haram olduğunu öyrədirlərsə, doğru etiqadın nə olduğunu bəyan edirlərsə, məqamında gələcəkdən xəbərlər verirlərsə, Quranda Allahın həqiqi qəsdinin nə olduğunu izah edirlərsə və bütün bunları edərkən öz rəylərinə əsasən etmirlərsə, bu elmlərin ciddi bir hissəsini ya ilham ilə, ya Müqəddəs Ruh vasitəsilə, ya da mələklərlə danışmaq yolu ilə əldə edirlərsə bunun şəriətimizdə tək bir adı vardır və buna vəhy deyilir. Bu əlbəttə ki, Allahın arılara vəhy etməsi, Musanın anasına vəhy etməsi ilə eyniləşdirilə bilməz, çünki məqam təbliğ məqamıdır, məqam insanlara haqqı öyrətmək məqamıdır və ona görə də imamət də peyğəmbərlik məqamı kimi ilahi bir məqam hesab olunub. Ona görə də əl-Məclisi rəvayətlərdə peyğəmbərlə imam arasında keçən fərqlərin problemli olduğunu etiraf etməli olur. O deyir: "Bil ki, peyğəmbərlə imamın arasındakı fərqi təhqiq etmək və bunu həmin xəbərlərdən çıxarmaq problemsiz alınmır. Bu ikisi ilə digər xəbərlərin arasını birləşdirmək də … həddindən artıq problemlidir. Bu xəbərlərin əksəriyyətindən mənə aydın olan bu oldu ki, imam şəri bir hökmü yuxuda görməz, peyğəmbər isə görə bilər." əl-Məclisi daha sonra başqa ehtimallara da yer verir; misal üçün qeyd edir ki, imamlar rasulların naibləri olaraq təbliğ edirlər, peyğəmbərlər isə özləri əsl olaraq təbliğ edirlər, lakin əl-Məclisi əlavə edir ki, imamların "bu naiblikləri (peyğəmbərlərin) əsalətindən daha şərəfli və daha üstün mərtəbədir." Belə çıxır ki, naiblik imamları daha da üstün qılmış olur, onları mərtəbə baxımından aşağıya salmır. Daha bir möhtəməl fərq isə əl-Məclisi'yə görə bu ola bilər ki, mələklər peyğəmbərlərə öyrətmək məqsədi ilə xəbər verirlər, imamlara isə diqqətə çatdırmaq məqsədi ilə xəbər verirlər. Burada da imamların məqamı peyğəmbərlərin məqamından üstün görünür. əl-Məclisi bu möhtəməl fərqlərin hamısının problemli olduğunu, xəbərlər işığında bunları həll etməyin mümkün olmadığını qəbul etdiyi üçün sözünün axırında buyurur: "Yekun olaraq bizim qəbul etməyimiz lazımdır ki, imamlar peyğəmbərlər deyillər və onlar peyğəmbərimiz istisna olmaqla qalan digər peyğəmbərlərdən və vasilərdən daha fəzilətli və şərəflidirlər. Onların peyğəmbərlik məqamı ilə vəsf

---

[482] Şubbər, "Misbəh əl-Ənvar fi Həlli Muşkilət əl-Əxbər", 2/319;

olunmamaqları üçün hansısa bir səbəb bilmirik, bildiyimiz tək bir səbəb peyğəmbərlərin sonuncusu - salləllahu aleyhi va əlihi - məqamının böyüklüyünü nəzərə almaqdır və bizim əqlimiz peyğəmbərlik ilə imamlıq arasında bir fərqin olduğunu dərk edə bilmir."[483] əl-Məclisi'nin səmimiyyətini burada təqdir etmək lazımdır, çünki xəbərlərdə qarşıya atılan fərqlərin heç biri mahiyyət baxımından peyğəmbərlə imam arasında hansısa bir fərqin olduğunu isbat etmir. Çünki xəbərlərdə göstərilən fərqlər peyğəmbərlərin öz aralarında da olub, çünki bütün peyğəmbərlər eyni dərəcədə olmayıb. əl-Məclisi bunu başa düşdüyü üçün etiraf edir ki, mahiyyət baxımından hansısa bir fərqin olduğunu bilmir, sadəcə olaraq İslam şəriəti Muhəmmədi - aleyhissalətu vassələm - sonuncu peyğəmbər adlandırdığı üçün imamlara peyğəmbər adını vermək olmaz. əl-Məclisi "Bihər əl-Ənvar" kitabında Əlinin "mən və o, eyni yol üzərindəyik" sözünə şərh verərkən deyir: "Yəni ki, mən onun (yəni peyğəmbərin) bütün kamilliklərdə şərikiyəm, mənimlə onun arasındakı tək bir fərq budur ki, onun adı mənim adımdan fərqlidir. Burada "ad" ilə qəsd olunan mənanın "peyğəmbərlik" olması möhtəməldir. Ya da ola bilsin ki, burada qəsd olunan məna budur ki, Allah onu Quranda adı ilə çağırıb, məni çağırmayıb. Birinci məna daha aşkardır."[484] Buradan başa düşürük ki, İmam Əli ilə Muhəmməd peyğəmbər arasındakı yeganə fərq ikincisinin "peyğəmbər" adlanmasında olub, mahiyyət və fəzilət baxımından aralarında heç bir fərq olmayıb.

Bəsim əl-Hilli'nin qeyd etdiyi fərq də mahiyyət baxımından həqiqi heç bir fərqi isbat etmir, çünki bir çox peyğəmbər özündən əvvəlki rasulun şəriətinə tabe olaraq göndəriliblər, bütün peyğəmbərlər özlərindən əvvəlkilərin şəriətini nəsx etməyiblər. əl-Mufid özü bu mənanı izah edərək deyir: "İmami şiələri ittifaq ediblər ki, hər bir rasul peyğəmbərdir, lakin hər bir peyğəmbər rasul deyildir. Allahın - azzə va cəllə - peyğəmbərləri arasında rasulların şəriətini qoruyanlar, məqam baxımından onların xəlifələri olanlar olub və bizim imamların peyğəmbərlər adlandırılmasını qadağan edən sadəcə olaraq şəriətdir, yoxsa əql bunu qadağan etmir, çünki zikr etdiyimiz peyğəmbərlərin - aleyhimussələm - sahib olduqları mənaya onlar da sahib olublar."[485] Bəli, doğru oxudunuz. Həqiqətdə məna və mahiyyət baxımından imamlar da peyğəmbərlərdir, lakin onların peyğəmbər adlanmaması

---

483 əl-Məclisi, "Mirətul-Uqul", 2/290;

484 əl-Məclisi, "Bihər əl-Ənvar", 25/355;

485 əl-Mufid, "Əvail əl-Məqalət", səh: 45;

şəriətdə onlar üçün bu adın işlənməsinin qadağan olunmasına görədir, daha dəqiq desək Muhəmməd əl-Mustafa - salləllahu aleyhi va səlləm - peyğəmbərlərin sonuncusu adlanmasaydı o zaman imamlar da peyğəmbərlər adlanacaqdılar. Şiə alimlərindən imamların vəzifələrinin nə olduğunu soruşduğunuzda onlardan alacağınız cavablar arasında bunu da eşidəcəksiz ki, imamlar Muhəmmədin şəriətinin qoruyucularıdırlar. əl-Mufid də burada bəzi peyğəmbərlərin vəzifələrinin məhz bu olduğunu təsdiqləyir. O da əl-Məclisi kimi təsdiqləyir ki, imamların peyğəmbərlər adlandırılmamasının yeganə səbəbi şəriətin ləfz olaraq bu ikisini bir-birindən ayırmasıdır, yoxsa məna və mahiyyət baxımından arada heç bir fərq yoxdur. Eyni mənanı şiələrdə fəqih və mühəddis olaraq tanınmış Süleyman bin Abdilləh əl-Həcuzi əl-Bəhrani (1075-1121) belə ifadə edir: "(İmamların) peyğəmbərlik adından məhrum olmaqlarının səbəbi onların - nə təklikdə, nə də çoxluqda - peyğəmbərlərin məqamından qüsurlu olmaqlarına görə deyildi, lakin sadəcə olaraq zahiri mövcudiyyətdə sonuncu peyğəmbərdən sonra gəldikləri üçün bu, mahiyyət olaraq yox, ad olaraq (onlardan peyğəmbərlik məqamını) məhrum etməyi gərəkdirib. Digər peyğəmbərlər isə zahiri mövcudiyyətdə sonuncu peyğəmbərdən əvvəl yaşadıqları üçün onlara bu adın verilməsinə heç bir maneə olmayıb, çünki onlara bu adın verilməsini gərəkdirən məqamlara yetişmişdilər."[486] əl-Həcuzi bu sözləri ilə təsdiqləyir ki, imamların peyğəmbər adından məhrum olmaqlarının yeganə səbəbi onların fiziki olaraq sonuncu peyğəmbərdən - aleyhissalətu vassələm - sonra gəlməkləri olub; bu o deməkdir ki, imamlar əgər peyğəmbərimizdən əvvəl yaşamış olsaydılar onlara da peyğəmbər adı veriləcəkdi. əl-Həcuzi'dən əvvəl yaşamış və şiələrdə üçüncü şəhid ləqəbi ilə tanınan Nuruddin ət-Tustəri (h. 1019) yazır: "Əgər nübüvvət dedikdə... sözü gedən (peyğəmbər kimi) göndərilməyin qaynağı olan kamil nəfsi sifət nəzərdə tutulursa, bu sifətin imamlarımıza – aleyhimussəlam – aid olması mümkünsüz deyil. Ən uzağı demək olar ki, Peyğəmbərimizin – salləllahu aleyhi və alihi va səlləm – sonuncu peyğəmbər olmağı onların xüsusi bir tərzdə göndərilməsinə və bu adın onlar üçün şəriət baxımından işlədilməsinə mane olmuşdur."[487] Xüsusi bir tərzdə göndərilməklə qəsd olunan yeni bir şəriət və kitabla göndərilməkdir. Sözün məğzi budur ki, nəfsin kamilliyi baxımından və sifətlər baxımından imamlar ilə peyğəmbərlər arasında bir fərq yoxdur

---

[486] əl-Həcuzi, "əl-Ərbəun Hədisən fi İsbət İməməti Əmir əl-Muminin", səh: 400;

[487] ət-Tustəri, "Məsaibun-Nəvasib", 2/68-69;

və imamların peyğəmbər adlanmamaqlarının yeganə səbəbi şəriətin bunu qadağan etməsidir, yoxsa mahiyyət baxımından eynidirlər. ət-Tustəri yenə eyni mənanı təsdiqləyərək buyurur: "Onların nübüvvət adından məhrum olması, nə təklik məqamında, nə də çoxluq məqamında o peyğəmbərlərin dərəcələrindən aşağı olduqları üçün deyil. Əksinə, onların zahirdə mövcudluqları baxımından xatəm (sonuncu peyğəmbər) olanın arxasından gəlməkləri, onları bu adın verilməsindən məhrum etmişdir, onlardan başqa olan peyğəmbərlər isə zahirdə mövcudluq baxımından xatəmdən əvvəl gəldikləri üçün, bu adın onlara verilməsinə heç bir maneə yox idi və bu adın onlara verilməsini tələb edən məqamlara çatdıqları üçün, bu adı onlara verilmişdir. Lakin bu, onların bu addan məhrum olanlardan daha üstün olduqlarını göstərmir, çünki bu adın başqalarına aid edilməsini təmin edən məqamlarda onlar bu məhrum olanlarla bərabərdirlər. Üstəlik, onlar Muhəmmədi qütblə şərəfləndikləri üçün bu adın verilmədiyi şəxslərdən daha üstün olmuşlar."[488] İmamlığın peyğəmbərliklə əslində mahiyyət cəhətdən eyni olduğunu, lakin sadəcə olaraq adda fərqləndiklərini bizə başqa bir üslubla əs-Saduq ləqəbli İbn Bəbəveyh əl-Qummi xatırladır. O, deyir: "Bizim müxaliflərimizin imamlarla peyğəmbərlərin bir-birinə bənzəmədiyini iddia edərək irəli sürdükləri etirazı batil edən sübutlardan biri budur ki, Peyğəmbərimizdən - salləllahu aleyhi və alih - əvvəl gələn rəsulların vasiləri də peyğəmbərlər olmuşdur. Hər bir vasi, özündən əvvəl gələn höccətin vasisi olaraq, Adəmin - aleyhissələm - vəfatından başlayaraq Peyğəmbərimizin - salləllahu aleyhi və alih - dövrünə qədər peyğəmbər idi. Məsələn, Adəmin - aleyhissələm - vasisi oğlu Şis idi və o, Muhəmməd Əhli-Beytinin elmində o, "Hibətullah" olaraq tanınır və bir peyğəmbər idi. Nuhun - aleyhissələm - vasisi oğlu Sam idi və o da peyğəmbər idi. İbrahimin - aleyhissələm - vasisi oğlu İsmail idi və o da peyğəmbər idi. Musanın - aleyhissələm - vasisi Yuşə ibn Nun idi və o da bir peyğəmbər idi. İsanın - aleyhissələm - vasisi Şəmun əs-Səfa idi və o da peyğəmbər idi. Davudun - aleyhissələm - vasisi oğlu Süleyman idi və o da peyğəmbər idi. Lakin Peyğəmbərimizin - salləllahu aleyhi və alih - vasiləri peyğəmbərlər olmadılar, çünki Allahu təala Muhəmmədi - salləllahu aleyhi və alih - onun üçün bir kəramət və üstünlük olsun deyə bu ümmətlərin sonuncu peyğəmbəri etdi. Beləliklə, imamlar və peyğəmbərlər vəsiyyət vasitəsilə bir-birlərinə bənzədilər, eyni şəkildə daha əvvəl də qeyd etdiyimiz bənzərliklərdə də oxşar oldular. Çünki

[488] Eyni mənbə, 2/77-78;

peyğəmbər vasidir və imam da vasidir, vasi imamdır və peyğəmbər də imamdır. Peyğəmbər höccətdir və imam da höccətdir. Şəklən bu qədər bir-birinə oxşayan ikinci bir nümunə yoxdur. Bundan başqa, Peyğəmbərimiz - salləllahu aleyhi və alih - bizə xəbər vermişdir ki, əvvəlki və sonrakı vasilərin əməlləri bir-birinə bənzəyir. Məsələn, Musanın - aleyhissələm vasisi Yuşə ibn Nun ilə Musanın - aleyhissələm - həyat yoldaşı Şueybin qızı Safura arasındakı hadisə ilə Peyğəmbərimizin - salləllahu aleyhi və alih - vasisi möminlərin əmiri - aleyhissələm - ilə Aişə bint Əbu Bəkr arasındakı hadisə bir-birinə bənzəyir. Eləcə də, peyğəmbərlərin vəfat etdikdən sonra öz vasiləri tərəfindən yuyulmasının vacib olduğu bizə xəbər verilmişdir."[489] əs-Saduq burada açıq şəkildə qeyd edir ki, şiələrin imamları keçmiş ümmətlərin peyğəmbərləri ilə eynidir, aradakı yeganə fərq budur ki, onlar peyğəmbər adına layiq olublar, çünki Peyğəmbərimizdən əvvəl yaşayıblar, imamlar isə peyğəmbər adını ona görə ala bilməyiblər ki, çünki Peyğəmbərimizdən - salləllahu aleyhi va səlləm - sonra yaşayıblar və Peyğəmbərimizin sonuncu peyğəmbər adı ilə şərəfləndirilməsi imamları bu addan məhrum edib. Ruhullah əl-Xomeyni isə bunu daha maraqlı bir şəkildə şeyxindən nəql edərək deyir: "Şeyximiz və ilahi maarifdə ustadımız, kamil arif Şahabadi[490] – Allah müridlərinin başı üzərində onun kölgəsini davamlı etsin – buyurmuşdur: 'Əgər Əli - aleyhissələm - Peyğəmbərdən - salləllahu aleyhi və alih - əvvəl zühur etsəydi, Peyğəmbər - salləllahu aleyhi və alih - kimi şəriəti bəyan edərdi və göndərilmiş bir peyğəmbər olardı. Çünki onlar ruhaniyyətdə, mənəvi və zahiri məqamlarda eynidirlər."[491]

Bütün bu deyilənləri təsdiqləyən tərəf budur ki, şiə alimləri kitablarında dönə-dönə, təkrar-təkrar qeyd edirlər ki, imamların vəzifələri, onların məsum və höccət olmaqları peyğəmbərdəkilərlə eynidir. Qutbuddin ər-Ravəndi (h. 573) deyir: "İmamət nübüvvətin əkizidir. O, nübüvvətin əsasının vacib və fərz olunmuş bir qolu, onun bir şərti və tamamlayıcısıdır."[492] əl-Alləmə əl-Hilli isə yazır: "İmam (Əli) - aleyhissələm - bütün mərtəbələrdə ən son həddə çatmaqda

---

[489] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", 1/26-27;

[490] Mirzə Məhəmməd Əli bin Məhəmməd Cavad əl-Hüseynabadi əl-İsfahani əş-Şahabadi (h. 1292–1369), fiqh, üsul, irfan və fəlsəfə sahələrində dördüncü hicri əsrin şiə alimlərindən biri idi.

[491] əl-Xomeyni, "Misbəhul-Hidəyə iləl-Xiləfəti val-Viləyə", səh: 90;

[492] ər-Ravəndi, "Minhəcul-Bəraa", 2/444;

peyğəmbərə bərabərdir."[493] əl-Hilli imam Əlinin mərtəbə baxımından sonuncu peyğəmbərə bərabər olduğunu bu sözləri ilə təsdiqləyir, aradakı fərq sadəcə addadır. Bunu Mirzə Əhməd əl-Əştiyəni (h. 1395) də təsdiqləyir: "Əli - aleyhissələm - peyğəmbərlikdən başqa bütün sifətlərdə və bacarıqlarda Peyğəmbərlə - salləllahu aleyhi va əlihi - eyni mərtəbədədir."[494] Seyyid Həsən əl-Ləvasəni (h. 1400) isə deyir: "Bütün bunlarla aydın oldu ki, vasi (yəni Əli) - aleyhissələm - Peyğəmbərlə - salləllahu aleyhi və alih - eyni məqamdadır. Hətta o, Peyğəmbərin öz nəfsi kimidir, necə ki, bu, Peyğəmbərin - salləllahu aleyhi və alih - dilindən nəql olunmuş və Mubahilə ayəsi ilə açıq şəkildə bəyan edilmişdir. O, Peyğəmbərlə - salləllahu aleyhi və alih - kamillik xüsusiyyətlərində, məsumluq məqamında, saysız-hesabsız gözəl sifətlərdə, zatının paklığında və əxlaqının gözəlliyində eynidir və ona ortaqdır."[495] Muhəmməd Həsən ən-Nəcəfi (h. 1266) mübaliğələr edərək imamlar haqqında yazır: "Onların gözləri yatar, lakin qəlbləri yatmaz. Onların yuxu halı ayıq olduqları hal kimidir və yuxu onların idrakına və mərifətinə heç bir dəyişiklik gətirməz. Onlar ehtilam olmazlar, şeytanın təsirinə məruz qalmazlar, əsnəməzlər və heç bir halda gərnəşməzlər. Onlar arxalarını, önlərini gördükləri kimi görərlər. Onların kölgəsi olmaz və onların sidiyi ilə nəcisi görünməz. Onların nəcislərinin qoxusu müşk qoxusu kimidir və yerə əmr olunmuşdur ki, onu gizlətsin və udub yox etsin."[496] Hətta demək olar ki, imamət məqamı şiələrə görə nübuvvət, yəni peyğəmbərlik məqamından üstün və daha əfzəl olduğu üçün imamət öz içində həm də nübuvvətin məsuliyyətini daşıyır. Şiə alimlərindən Muhəmməd Baqir əl-Həkim yazır ki, "imamət dərəcə baxımından nübuvvətdən daha üstün olduqda, onda nübuvvətin boyutlarının və məsuliyyətlərinin də ən yüksək dərəcədə onda bir araya gəlməsi labüddür. Hətta deyə bilərik ki, imamət məqamı özlüyündə nübuvvət məqamının təkamülünü və yüksəlişini əks etdirir…"[497] Muhəmməd Baqir əl-Həkim sıradan bir alim deyildir, şiə hövzələrində və elmi fəaliyyətində ən üst düzənə mənsub olan bir şəxsiyyətdir. Bütün bu sözlər eyni nöqtəyə vurur: imamla mahiyyət etibarı ilə peyğəmbər arasında bir fərq yoxdur, imamlar da elə mahiyyətcə peyğəmbərdir, sadəcə olaraq şəriət onlara

---

[493] əl-Hilli, "əl-Əlfeyn", səh: 395;

[494] əl-Əştiyəni, "Ləvamiul-Haqaiq fi Usulil-Aqaid", 2/19;

[495] əl-Ləvasəni, "Nurul-Əfhəm fi İlm əl-Kələm", 1/613;

[496] əl-Cəvahiri, "Cəvahirul-Kələm", 13/75;

[497] əl-Həkim, "əl-İmamə va Əhlul-Beyt; ən-Nəzəriyyə val-İstidləl", səh: 23;

başqa ad verdiyi üçün şiələr onlara peyğəmbər demirlər, amma qalan hər şeydə onların peyğəmbər olduqlarına inanmaqda bir problem görmürlər, hətta peyğəmbərlərdən daha üstün olduqlarını açıq şəkildə qəbul edirlər. İmamlara bu dərəcədə şişirdilmiş məqamlar nisbət edildikdən sonra heç də qəribə deyil ki, İblisin küfrünü izah etməyə çalışan əs-Saduq deyir: “Allah - azzə va cəllə - (Adəmin belində) onların gözlərindən gizlətdiklərinə təzim olsun deyə mələkləri ona səcdə etdirməklə kölələşdirmiş oldu. Beləki O - azzə va cəllə - Adəmə səcdə etməklərini yalnız ona görə əmr etdi ki, çünkiu zikri uca Allahın höccətlərinin ruhlarını Adəmin sülbünə yerləşdirmişdi. Beləliklə, bu səcdə Allah-Təalaya ubudiyyət (köləlik, bəndəlik), Adəmə itaət və belindəki ruhlara təzim üçün idi. Lakin İblis Adəmə səcdə etməkdən imtina etdi, çünki Allah höccətlərin ruhlarını onun belinə deyil, Adəmin belinə yerləşdirmişdi. Bu səbəbdən, o, paxıllığı, üsyanı və Rəbbinin əmrinə itaət etmədiyinə görə kafir oldu, Allahın əmrinə qarşı fasiq oldu və qeybəti inkar etdiyi üçün Allahın hüzurundan qovuldu, lənətləndi və Racim adlandı.”[498] Bu həddindən artıq aşırı və mübaliğəli vəsflər əlbəttə ki, imamlar haqqında həddi aşmağın ən aşkar misallarındandır. İslam dininin az qala ən əsas məsələlərini bu və ya digər şəkildə imamlara bağlamaq cəhdidir. Əgər bütün bunlar həqiqətdirsə bu barədə Quranda və sünnətdə aşkar dəlillərin gəlməməsi xeyli təəccüblüdür.

Burada mütləq eyni suala təkrar qayıtmağımız lazımdır. Təbliğ, məsumluq, möcüzə kimi peyğəmbərin vəzifə və xüsusiyyətlər sonuncu peyğəmbərin vəfatı ilə durmayıbsa, əksinə ondan sonrakı on iki imamda davam edibsə o zaman “sonuncu peyğəmbər” etiqadının mənası nədir?! Belə görünür ki, şiələrdə bu titul sadəcə olaraq içi boş olan “bir məqamı” İslam peyğəmbərinin adına yapışdırmaqdan başqa bir şeyə xidmət etmir. Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfat etdikdə müsəlmanları üzən səbəblərdən biri də bu oldu ki, səma ilə Yer arasındakı ilahi bağlantı kəsilmiş oldu. Ənəs bin Malik deyir: “Peyğəmbərin - salləllahu aleyhi və səlləm - vəfatından sonra Əbu Bəkr - radiyallahu anhu - Ömərə dedi: 'Gəl, Ummu Əymənin yanına gedək, Peyğəmbər - salləllahu aleyhi və səlləm - onu ziyarət etdiyi kimi biz də onu ziyarət edək.' Onun yanına çatdıqda o, ağladı. Onlar ona dedilər: 'Səni ağladan nədir? Axı Allahın yanında olan, Allahın elçisi - salləllahu aleyhi və səlləm - üçün daha xeyirlidir.' O dedi: 'Allahın qatında olanın Allahın rasulu - salləllahu aleyhi və səlləm - üçün daha xeyirli olduğunu

[498] əs-Saduq, “Kəməlud-Din va Təməmun-Nimə”, 1/12

bilmədiyim üçün ağlamıram, lakin artıq göydən vəhy kəsildi deyə ağlayıram.' Onun sözləri onların da ağlamasına səbəb oldu və onlar da onunla birlikdə ağladılar."[499] Axı Ummu Əymən nə üçün bilmirdi ki, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - vəfatı ilə səma ilə yer arasındakı bu ilahi bağlantı kəsilmir, əksinə imamlar ilə davam edir. Dəyişən təkcə bir şey var; o da peyğəmbər adının imam adı ilə əvəz edilməsidir. Çünki imam hər bir şeydə peyğəmbər kimidir, bir peyğəmbər üçün mümkün olan hər bir şey imamlar haqqında vacib olmalıdır. əs-Saduq deyir: "Peyğəmbərlərə caiz olan hər bir şey imamlar üçün də vacib və zəruridir, daban-dabana, oxun tükü oxun tüklərinə uyğun olduğu kimi."[500] İmamların da "elmi" - Həsən bin Əli əl-Kərki dediyi kimi - "rasullarda və peyğəmbərlərdə olduğu kimi ictihadi yox, ləduni'dir."[501] əl-Feyd əl-Kəşəni də təsdiqləyir ki, "imamların elmləri ictihadi deyildir, hiss orqanları ilə əldə etdikləri səm'i elmlər də deyildir, lakin Peyğəmbərə - salləllahu aleyhi va əlihi - tabe olmağın bərəkəti ilə Allahdan - subhənəhu - aldıqları ləduni elmdir."[502] Şeyx Bəqir Şərif əl-Quraşi də yazır ki, "imamların - aleyhimussələm - elmi peyğəmbərlərin elmi kimidir, ikisi arasında heç bir fərq yoxdur."[503] Əgər peyğəmbər elminə, peyğəmbər məsumiyyətinə, peyğəmbər vəzifələrinə, peyğəmbər möcüzələrinə sahibdirsə, peyğəmbər kimi sözü və feli hüccətdirsə, peyğəmbər kimi itaət olunması fərzdirsə o elə peyğəmbərdir. Adını dəyişmək reallığı dəyişdirməz. Bir meyvənin forması, quruluşu, rəngi, dadı, qoxusu tamamilə eynidirsə onun adını dəyişmək mahiyyətini dəyişdirməz. İmamlar ilə peyğəmbər arasında vəhyin necəliyində fərq qoymaq da bu reallığı dəyişdirməz, yuxarıda izah etdiyimiz kimi bu kimi fərqlər peyğəmbərlərin özləri arasında da olub. Ona görə də Əli bin Yunus əl-Bəyadi əl-Amili (h. 877) deyir: "Əgər deyilərsə ki, "Allah-Təalanın '*insanlara onlara nazil ediləni bəyan edəsən*' [16:44] buyruğu, bəyan etmənin imama xas olduğunu iddia etməyinizi batil edir." Biz deyərik ki, əgər elm unutmayan və cahillik etməyən bir hafizə verilərsə və insanlara ona müraciət etmək tapşırılarsa, o zaman sizlərin irəli sürdüyünüz etiraz süqut edər. Əgər deyilərsə ki, "Peyğəmbərin - salləllahu aleyhi və alih - dinindən məlum olan budur ki, vəhy kəsilib və bu, sizin (imamların) mələklərlə

---

[499] "Sahih Muslim", (2454)

[500] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", 1/22;

[501] əl-Kərki, "Umdətul-Məqal fi Kufr Əhlid-Daləl", səh: 55-56;

[502] əl-Kəşəni, "əl-Usul əl-Əsilə", səh: 30-31;

[503] əl-Quraşi, "Bidəyətul-Məarif əl-İləhiyyə", 1/281;

danışmaqları haqqındakı iddianızı batil edər", biz deyərik ki, icma yalnız peyğəmbərliyin sona çatmasındadır, lakin mələklərin artıq heç kimlə danışmayacağına dair icma yoxdur."[504] Fazil əl-Lənkərani kitabında bu sual-cavab şəklində belə ifadə edir: "İmam - aleyhissələm - qeybi bilirmi, yoxsa bilmir? Cavab: Bəli, o, qeybi bilir. Lakin bunu vəhy, ilham və ya Allah-Təalanın onların kökslərini genişləndirmək yolu ilə bilirlər və köks genişlənməsi onların önündə pərdələri qaldırır və beləliklə, onlar şeylərin həqiqətlərini görürlər."[505]

Bütün bu yazdıqlarımızın işığında deyə bilərik ki, Peyğəmbərimizin - aleyhissalətu vassələm - özündən sonra peyğəmbər məqamının olmadığını deməsi həm də mahiyyət etibarı ilə o məqamla eyni olan hər bir şeyi istisna edir. Çünki bir şeyin mahiyyətini saxlayıb, yalnız adını ləğv etmək şəriətin hikmətinə yaraşan bir iş deyildir.

## Ğadir hədisi

Ğadir hədisi şiələrdə ən önəmli dəlillərdəndir, hətta hədislər arasında ən önəmli dəlil məhz ğadir xum hadisəsi sayılır. Bunun ən aşkar sübutu budur ki, bu günü şiələr bayram edirlər, onların nəzərində ən fəzilətli bayram bu günün bayramıdır. Həmçinin bu günü oruc tutmağın fəzilətinə dair kitablarında rəvayətlər vardır.

Ğadir Xum hadisəsi fərqli mətnlərdə rəvayət olunub; bunların bir hissəsi sadəcə Əlinin fəziləti olaraq rəvayət olunur və bunun səbəblər haqqında geniş bir məlumat vermir. Bəziləri isə peyğəmbərin - aleyhissalətu vassələm - sözlərini qeyd etmədən əvvəl hadisələrin necə cərəyan etdiyini və peyğəmbərin nə üçün Əli haqqında o sözləri dediyini də rəvayət edir. Bu hadisə şübhəsiz ki, Əli bin Əbi Talib'in fəzilətinə dəlalət edir. Əbu Tufeyl deyir: "Əli – radiyallahu anhu – insanları (Kufə məscidinin) həyət(in)də topladı, sonra onlara dedi: "Sizi

---

[504] əl-Amili, "əs-Sirat əl-Mustəqim", 2/176;

[505] əl-Lənkərani, "Həmətul-Vəhy", səh: 197-198;

Allaha and verirəm, hər bir müsəlman kəs Allahın elçisini – salləllahu aleyhi va səlləm – Ğadir-Xum günü nə deyərkən eşitdiyini desin!" Ayağa qalxdığında otuz nəfər qalxdı." Əbu Nueym deyir: "Çox insan qalxdı və şahidlik etdilər ki, (peyğəmbər) onun əlini qaldırdıqda insanlara dedi: "Bilmirsinizmi ki, mən möminlərə özlərindən daha əvlayam?" Dedilər: "Bəli, ey Allahın elçisi!" Dedi: "Mən kimin mövlasıyamsa bu da onun mövlasıdır. Allahım onu sevəni sev, ona düşmənlik edənə düşmənlik et!" Dedi: "Mən ordan ayrıldım və sanki nəfsimdə bir şeylər var idi. Zeyd bin Ərqam ilə qarşılaşdım və ona dedim: "Əlini – radiyallahu anhu – belə deyərkən eşitdim..." Dedi: "İnkar etdiyin nədir? Mən Allahın elçisini – salləllahu aleyhi va səlləm – onun üçün bunu deyərkən eşitdim."[506] Bunu həmçinin Said bin Vəhb də rəvayət edir, orada on beş və ya on altı səhabənin ayağa qalxıb şahidlik etdiyini deyir.[507] Anlaşıldığı kimi bu fəzilət sıradan bir fəzilət deyildi, əks təqdirdə Əli bin Əbi Talib Kufə məscidində müsəlmanların qarşısında bu fəziləti xüsusiləşdirməzdi.

Bureydə deyir: "Əli ilə birlikdə Yəməndə hərbi yürüşdə idim və ondan bir az cəfa gördüm. Allahın elçisinin – salləllahu aleyhi va səlləm – yanına gəldiyimdə Əlini zikr etdim və onu pislədim. Bu zaman Allahın elçisinin – salləllahu aleyhi va səlləm – üzünün dəyişdiyini gördüm və dedi: "Ey Bureydə, mən möminlərə özlərindən daha əvla deyiləmmi?" Dedim: "Bəli, ey Allahın elçisi!" Dedi: "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır."[508] Bu hədisi bu şəkildə bir çox ravi qısa olaraq rəvayət edirlər. Sünnət əhli qeyd edir ki, hədisi anlamaq üçün onun arxasında duran səbəbləri də anlamaq lazımdır. Hadisələrin başlanğıcı peyğəmbərin - aleyhissalətu vassələm - Əlini Yəmənə göndərməsi ilə başladı. əl-Bəra bin Azib deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - Xalid bin əl-Valid'i Yəmənə onları İslam dininə dəvət etmək üçün göndərmişdi. Mən də onunla birlikdə gedənlər arasında idim. Onlarla doqquz ay məşğul oldu, lakin İslam dininə dəvətə heç cür cavab vermədilər. Allahın elçisi - salləllahu aleyhi va səlləm - onun arxasınca Əli bin Əbi Talib'i göndərdi və ona əmr etdi ki, Xalid bin əl-Valid və onunla olanlar geri dönsünlər; əgər Xalid bin əl-Valid ilə birlikdə olanlardan kimsə onunla (yəni Əli ilə) getmək istərsə onu (yəni Xalidi) tərk etsin." əl-Bəra deyir: "Əli ilə birlikdə Yəmən əhlinin böyüklərinin

---

[506] "Musnəd Əhməd", 32/56 (19302), Muəssəsətur-Risələ; Şeyx Şueyb isnadının səhih olduğunu deyir.

[507] "Musnəd Əhməd", 38/193 (23107), Şeyx Şueyb isnadının səhihliyini təsdiqləyir.

[508] "Musnəd Əhməd", 38/32 (22945), ər-Risələ; İsnadı səhihdir.

yanına gedənlərdən idim. Ona görə də (yəmənlilərin böyükləri) onun üçün bir araya toplaşdılar." Deyir: "Əli bin Əbi Talib bizə fəcr namazını qıldırdı, namazı bitirdikdə bizi bir sıraya düzdü, sonra qarşımıza keçdi. Allaha həmdü-səna gətirdi, sonra onlara Allahın elçisinin - salləllahu aleyhi va səlləm - məktubunu oxudu. Beləliklə də Həmdən qəbiləsinin hamısı bir gündə İslamı qəbul etdi. (Əli) bu barədə Allahın elçisinə - salləllahu aleyhi va səlləm - məktub göndərdi və onun məktubunu oxuduqda təkbir gətirib oturdu, sonra səcdə etdi və üç dəfə "Həmdən'ə salam olsun!" dedi. Onların ardınca Yəmən əhli müsəlmanlığı qəbul etdilər."[509] Burada əl-Bəra bin Azib bizə xəbər verir ki, peyğəmbərin - aleyhissələm - Əlini göndərməsində əsas məqsəd Yəmən qəbilələrini İslama dəvət etmək idi. Lakin görünür ki, burada başqa məqsədlər də var idi. əl-Buxari'nin "əs-Sahih" kitabındakı rəvayətində Bureydə əl-Əsləmi deyir: "Peyğəmbər - salləllahu aleyhi va səlləm - Əlini xumsu ayırmaq üçün Xalidin yanına göndərmişdi. Mən Əliyə (o vaxt) nifrət edirdim; qüsl almışdı, ona görə də Xalidə dedim: "Bunun etdiyini görürsənmi?" Peyğəmbərin - salləllahu aleyhi va səlləm - yanına gəldiyimizdə ona bunu xəbər verdim. Bunun üzərinə soruşdu: "Ey Bureydə, Əliyə nifrət edirsənmi?" Dedim: "Bəli." Dedi: "Ona nifrət etmə, çünki onun xumsda bundan da çox haqqı vardır."[510] İmam Əhməd "əl-Musnəd" kitabında belə rəvayət edir ki, Bureydə (bir gün) "bir məclisin yanından keçir və orada oturanlar Əli haqqında pis sözlər danışırdılar. Onların yanında durdu və dedi: "(Vaxtında) mənim də qəlbimdə Əliyə qarşı bir şey var idi. Xalid bin əl-Valid də mənim kimi idi. Allahın elçisi - salləllahu aleyhi va səlləm - məni Əlinin əmirliyi altında bir ordu dəstəsi ilə göndərmişdi. Əsirlər ələ keçirmişdik. Əli xumsdan bir cariyəni özünə götürdü. Xalid bin əl-Valid dedi: "Özünə düşəni götür!" Peyğəmbərin - salləllahu aleyhi va səlləm - yanına gəldiyimizdə olub bitənləri ona hekayət etdim, sonra dedim: "Əli xumsdan bir cariyə götürdü." Başımı aşağı salıb danışmaq mənim adətim idi, sonra başımı qaldırdım və bir də gördüm ki, Allahın elçisinin - salləllahu aleyhi va səlləm - üzünün rəngi dəyişib. Dedi: "Mən kimin vəlisiyəmsə Əli də onun vəlisidir."[511] Bir başqa rəvayətdə Bureydə deyir: "Əsirlər ələ keçirmişdik. (Xalid) Allahın elçisinə - salləllahu aleyhi va səlləm - yazdı ki, bizə qəniməti böləcək birini göndərsin. O da bizə

---

[509] "Musnəd ər-Ruyəni", 1/218 (304); əl-Beyhəqi "əs-Sunən əl-Kubra" kitabında (4/595; rəq: 3990, ət-Turki) qeyd edir ki, hədis əl-Buxari'nin şərtlərinə görədir.

[510] "Sahih əl-Buxari", 4093;

[511] "Musnəd Əhməd", 38/133 (23028); Şeyx Şueyb isnadının səhih olduğunu yazır.

Əlini göndərdi. Əsirlər arasında gənc bir qız var idi; əsirlərin ən gözəllərindən biri idi. (Qəniməti) böldü, beşdə birini ayırdı, sonra (qaldığı yerdən) çıxanda saçından su damlayırdı.” Biz dedik: “Ey Əbul-Həsən, bu nə deməkdir?” Dedi: “Əsirlər arasındakı gənc qızı görmədinizmi? Mən (qəniməti) böldüm, beşdə birini ayırdım və o, beşdə birinə düşdü. Sonra peyğəmbərin - salləllahu aleyhi va səlləm - ailəsinin payına düşdü, sonra isə Əlinin ailəsinin payına düşdü və mən onunla yaxınlıq etdim.” Dedi: “Sonra adam (yəni Xalid) Allahın peyğəmbərinə - salləllahu aleyhi va səlləm - məktub yazdı və dedim: “Məni göndər!” O da məni (yazdıqlarını) təsdiqləməm üçün göndərdi.” (Peyğəmbərin yanına çatdığımda) məktubu oxumağa başladım və “doğru deyir” dedim. Bunun üzərinə əlimi və məktubu tutdu və dedi: “Əliyə nifrət edirsən?” Dedim: “Bəli.” Dedi: “Ona nifrət etmə, əgər mənə qarşı sevgin varsa onu daha çox sev, çünki Muhəmmədin canını əlində tutana and olsun ki, Əlinin ailəsinin xumsdakı payı bir gənc qızdan daha çoxdur.” (Bureydə) dedi: “Allahın elçisinin - salləllahu aleyhi va səlləm - bu sözündən sonra insanların arasından heç kim mənə Əlidən daha sevimli deyildi.”[512] Görünür ki, Əli ilə bəzi səhabələr arasındakı problem burada bitmir. Əbu Said əl-Xudri deyir: “Allahın elçisi - salləllahu aleyhi va səlləm - Əli bin Əbi Talibi Yəmənə göndərdi və mən də onunla birlikdə gedənlər arasında idim. Zəkat dəvələrini topladıqda ondan istədik ki, o dəvələrə minək, öz dəvələrimiz istirahət etsin, çünki öz dəvələrimizdə zəiflik olduğunu görürdük. Razı olmadı və dedi: “Digər müsəlmanlara ondan bir pay düşdüyü kimi sizə də ondan bir pay düşür.” Əli işini tamamladıqda və Yəməndən çıxıb geri qayıtdığında bizim başımıza bir nəfəri əmir təyin etdi. Özü tələsdi və həccə yetişdi. Həccini başa vurduqda peyğəmbər - salləllahu aleyhi va səlləm - ona dedi: “Öz yoldaşlarına geri dön ki, onlara çatasan.” Əbu Said deyir: “Onun öz yerinə əmir olaraq tərk etdiyi adamdan Əlinin bizə qadağan etdiyini istədik, o da istədiyimizi etdi. Əli gəldikdə zəkat dəvələrinin minildiyini anladı, minmə əlamətlərini gördü. Buna görə də əmir təyin etdiyi şəxsi danladı və azarladı. Mən dedim ki, Mədinəyə çatdığımızda Allahın izni ilə Allahın elçisinə - salləllahu aleyhi va səlləm - bunları söyləyəcəm və qarşılaşdığımız sərtlik və təzyiq barəsində ona xəbər verəcəm.” Daha sonra Əbu Said Mədinə şəhərinə gəldikdə Allahın elçisinin - aleyhissalətu vassələm - yanına daxil olduğunu deyir. Dedim: “Ey Allahın elçisi, Əlidən gördüyümüz bu sərtlik, pis yoldaşlıq və təzyiq nədir?” Allahın elçisi - salləllahu aleyhi va səlləm - kənara

[512] “Musnəd Əhməd”, 38/67 (22967); Şeyx Şueyb isnadının həsən olduğunu deyir.

çəkildi və mən ondan gördüyümüz hərəkətləri saymağa başladım. Sözümün ortasındaykən Allahın elçisi - salləllahu aleyhi va sələm - buduma vurdu, ona yaxın oturmuşdum və dedi: “Ey şəhid nəvəsi Sad! Qardaşın Əli haqqında dediyin sözləri saxla! Allaha and olsun ki, mən onun Allah yolunda sərt davrandığını bilirəm.”[513] İmam Əhmədin rəvayətində isə Əbu Said əl-Xudri deyir: “İnsanlar Əlini şikayət etdilər.” Buna görə də Allahın elçisi - salləllahu aleyhi va səlləm - aramızda xütbə verdi və onu belə deyərkən eşitdim: “Ey insanlar, Əlidən şikayətlənməyin! Allaha and olsun ki, onun bir az sərt olması Allah üçündür.”[514] Bir başqa rəvayətdə Yezid bin Rukənə deyir: “Əli bin Əbi Talib'in onunla birlikdə Yəməndə olmuş ordusu ona görə üzüldü ki, çünki onlara geri döndüklərində (Əli) onların üzərinə bir nəfəri təyin etdi və (özü) xəbərləri çatdırmaq üçün Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına getdi. Təyin etdiyi adam hər bir kəsə (yeni) bir paltar geyindirdi. Yaxınlaşdıqlarında Əli - radiyallahu anhu - çıxaraq onları qarşıladı və gördü ki, üzərilərinə paltarları geyiniblər. Əli dedi: “Bu nədir?” Dedilər: “Bizi fılankəs geyindirdi.” Dedi: “Allahın elçisinin - salləllahu aleyhi va səlləm - istədiyi kimi etməyimiz varkən, onun yanına çatmadan əvvəl bunu etməyinə nə ehtiyac var idi?” Onların əynindən paltarları çıxardı. Onlar da Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına vardıqlarında ona bunu şikayət etdilər…”[515] Əbu Said əl-Xudri'nin xəbərindən anlaşılan budur ki, peyğəmbərə şikayət Mədinə şəhərində edilmişdi. Fəqət belə görünür ki, onların bir hissəsi daha əvvəl Məkkə tərəfdə peyğəmbərə - aleyhissələm - şikayət etmişdilər. Üstəlik bu xəbərlərdən anlaşılır ki, Əli - kərraməllahu vachəhu - prinsipial biri idi, haqq məsələlərində güzəşt etmirdi və Allah rızası üçün sərt davranmaqda bir problem görmürdü.

Bu xəbərləri oxuduğumuzda peyğəmbərin - aleyhissalətu vassələm - səhabələrinə Əlinin fəzilətini xatırlatmağının səbəbini anlamış oluruq. Əhlüs-sünnət alimlərindən əl-Beyhəqi yazır ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - Əlini “Yəmənə göndərdikdə ondan şikayət edənlər çoxaldı, ona nifrətlərini izhar etdilər. Buna görə də peyğəmbər - salləllahu aleyhi va səlləm - onun özünə necə yaxın olduğunu, onu nə qədər sevdiyini zikr etməyi, bununla da onları onu sevməyə, onu dost

---

[513] əl-Beyhəqi, “Dəlail ən-Nubuvvə”, 5/398; İbn Kəsir “əl-Bidəyə van-Nihəyə” kitabında (7/396; ət-Turki) deyir: “Bu, ən-Nəsəinin şərtinə görə ceyyid bir isnaddır. “Kutub əs-Sittə” sahiblərindən heç biri bunu rəvayət etməyib.”

[514] “Musnəd Əhməd”, 18/337 (11817); Şeyx Şueyb ravilərinin siqa olduğunu təsdiqləyir.

[515] əl-Beyhəqi, “Dəlail ən-Nubuvvə”, 5/395;

edinməyə, ona ədavət göstərməməyə təşviq etmək istəmişdir. Beləliklə də "mən kimin vəlisiyəmsə Əli də onun vəlisidir" demişdir. Bəzi rəvayətlərdə "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır, Allahım, onu sevəni sev, ona düşmən olana düşmən ol!" deyir. Qəsd olunan isə İslam dostluğu və sevgisidir. Müsəlmanlara bir-birilərini sevməkləri, birbirilərinə düşmənlik etməməkləri vacibdir…"[516] Digər sünnət alimi İbn Kəsir yazır: "Hasil olan budur ki, Əli haqqında həmin orduda dedi-qodu çoxalmışdı; onlara zəkat dəvələrindən istifadə etməyi qadağan etməsi və naibinin onlara buraxdığı paltarları onlardan geri alması buna səbəb olmuşdu. Əli isə etdiklərində üzrlü idi. Lakin həcc edənlər arasında onun haqqında söz-söhbət məşhurlaşdı. Buna görə də - doğrusunu Allah bilir! - Allahın elçisi - salləllahu aleyhi va səlləm - həccindən qayıtdıqda, həcc ayinlərini edib qurtardıqda və Mədinəyə geri döndüyündə Ğadir Xum deyilən yerdən keçdi. İnsanların qarşısında xütbə verdi və Əlinin adını təmizə çıxardı, onun dəyərini qaldırdı və diqqətləri onun fəzilətinə yönəltdi ki, insanların bir çoxunun qəlbində ona qarşı yaranmış narazılıqları aradan qaldırsın."[517] Sünnət alimləri bu hədisdəki "mövla" və ya "vəli" sözlərini "İslam dostluğu, İslam qardaşlığı, İslam sevgisi" mənalarında başa düşüblər. ər-Rabi bin Süleyman deyir: "əş-Şafi'ni peyğəmbərin - salləllahu aleyhi va səlləm - Əli bin Əbi Talib üçün dediyi "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" sözləri haqqında belə deyərkən eşitdim: "Bununla İslam vəlasını qəsd edir. Bu, Allahu təalənin bu sözləri kimidir: "Ona görə ki, Allah iman gətirənlərin dostudur/himayədarıdır. Kafirlərin isə dostu/himayədarı yoxdur!" (47:11)"[518]

İmami məzhəbində Ğadir Xum hadisəsinin tamamilə başqa səbəbləri olub və tamamilə fərqli bir məzmun içində cərəyan edib. əl-Kuleyni öz isnadı ilə rəvayət edir ki, İmam əl-Baqir deyib: "Allah - azzə va cəllə - elçisinə Əlinin vilayətini əmr etdi və ona bu ayəni nazil etdi: "Sizin vəliniz yalnız Allah, Onun elçisi və namaz qılıb rüku halında zəkat verənlərdir" və (həmçinin) "əmr sahiblərinin" itaətini fərz etdi. Onlar əmr sahiblərinin kimlər olduğunu bilmirdilər. Buna görə də Allah Muhəmmədə - salləllahu aleyhi va əlihi - onlara namazı, zəkatı, orucu və həcci izah etdiyi kimi vilayətin də nə olduğunu izah etməyi əmr etdi. Ona Allahdan bu əmr gəldikdə Allahın elçisinin - salləllahu aleyhi va əlihi - köksü daraldı, onların dinlərindən çıxıb mürtəd olmaqlarından,

---

[516] əl-Beyhəqi, "əl-İtiqad", səh: 354; Darul-Əfəq əl-Cədidə, Beyrut, 1401;

[517] İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 7/397; Dar Aləm əl-Kutub, Riyad, 1418;

[518] "Təfsir əl-İməm əş-Şafi", 3/1257; Dar ət-Tədmuriyyə, 1427

onu təkzib etməklərindən qorxdu. Beləliklə də buna görə rahatsız oldu və Rəbbinə buna bir daha baxması üçün üz tutdu. Buna görə də Allah - azzə va cəllə - vəhy endirdi: "Ey Peyğəmbər! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan. Allah səni insanlardan qoruyacaqdır." Buna görə də (peyğəmbər) Allahın əmrini aşkara çıxardı və Ğadir Xum günü Əlinin - aleyhissələm - vilayətini bərqərar etdi. Hamını bir araya gətirmək üçün namaz qıldırdı və insanlara əmr etdi ki, orada iştirak edənlər iştirak etməyənlərə təbliğ etsinlər.. Bir fərz nazil olduqdan sonra digəri nazil olurdu və vilayət ən sonuncu fərzdir, bundan sonra Allah - azzə va cəllə - bu ayəni endirdi: "Bu gün dininizi sizin üçün kamil etdim. Sizə olan nemətimi tamamladım…" (əl-Baqir dedi) Allah bununla deyir ki, bu fərzdən sonra sizə başqa bir fərz endirməyəcəm, sizin üçün fərzləri tamamladım."[519] Şiələrdə bir çox rəvayət bu ümumi məzmunu təsdiqləyir. Məzmun isə budur ki, peyğəmbər - aleyhissalətu vassələm - Məkkədə həcc əsnasında Arafada ikən ona Əlinin xəlifəliyi, vəliliyi barəsində Allahdan əmr gəlir, lakin Allahın elçisi - aleyhissalətu vassələm - bunu təbliğ etməkdən çəkinir, qorxur və gözləyir. Beş gün sonra geri qayıdarkən Ğadir Xum deyilən yerdə, yəni təqribən Məkkə ilə Mədinə arasındakı yolun ortasında yeni bir vəhy gələrək peyğəmbəri təhdid edir və təbliğ etmədiyi təqdirdə ona verilmiş missiyanı yerinə yetirməmiş olacağını xəbər verir. Beləliklə də peyğəmbər - aleyhissələm - məcbur olaraq Ğadir Xum'da dayanır, insanları toplayır və onlara xütbə verir, orada Əlini özündən sonra xəlifə elan edir. Orada iştirak edənlərin hamısı - şiə xəbərlərinə görə - Əliyə beyət edirlər. Yalnız bundan sonra dinin tamamlanması haqqında ayə enir və vilayətin ən sonuncu fərz olması bu ayə ilə öz təsdiqini tapır. İmam əl-Baqirə nisbət edilən bir rəvayətdə deyir ki, vilayət əmri "Arafada cümə günü ona gəldi… bu zaman Allahın elçisi - salləllahu aleyhi va əlihi - dedi: "Ümmətim cahillikdən yeni qurtulublar, onlara əmim oğlu haqqında bunu xəbər versəm danışanlar danışacaqlar…" Bunu dilə gətirmədən öz içimdə dedim. Bu zaman Allahdan - azzə va cəllə - mənə qəti göstəriş gəldi və məni təbliğ etmədiyim təqdirdə əzabla təhdid etdi…"[520] Belə görünür ki, şiə alimləri bu mənanı qəbul ediblər və inanıblar ki, peyğəmbər - aleyhissalətu vassələm - öz ümmətindən ehtiyat edirmiş, çəkinirmiş və Allahın əmrini qəbul etməyəcəklərindən

---

[519] əl-Kuleyni, "əl-Kafi", 1/289; əl-Məclisi "Mirətul-Uqul" kitabında (3/250) həsən olduğunu yazır.

[520] əl-Kuleyni, "əl-Kafi", 1/290; əl-Məclisi isnadının zəif olduğunu yazır.

qorxurmuş. Ona görə də şiə təfsir alimi ət-Tabətabəi yazır ki, "peyğəmbər - salləllahu aleyhi va əlihi va səlləm - bunu təbliğ etməkdə insanlardan qorxurdu və münasib bir vaxta qədər təxir edirdi, əgər onda bu qorxu və susqunluq olmasaydı onun təhdid olunmasına ehtiyac olmazdı…"[521] Şeyx əl-Mufid də yazır ki, "təbliği gecikdirməməsi üçün onu qorxutdu və onu qoruyacağına dair zəmanət verdi…"[522]

Ona görə də Ğadir Xum hadisəsi şiələrdə ən əhəmiyyətli hadisə sayılır və bundan önəmli başqa bir hadisə yoxdur. Bu əhəmiyyətin bir neçə göstərici var. Bunlardan biri budur ki, ğadir günü şiələrdə bayramdır, hətta ən böyük bayramdır. Bu gün üçün onlar oruc tuturlar və bu oruc onların nəzərində ən fəzilətli orucdur, çünki bu orucun savabı altmış ayın orucuna bərabərdir. Şeyx əs-Saduq öz isnadı ilə rəvayət edir ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - deyib: "Ğadir Xum günü ümmətimin ən əfzəl bayramıdır; bu o gündür ki, o gün Allahu təalə qardaşım Əli bin Əbi Talibi ümmətim üçün məndən sonra onlara hidayət rəhbəri olacaq sancaq olaraq təyin etməmi əmr etdi. Bu o gündür ki, həmin günü Allah dini kamil edib və ümmətim üzərində nemətini tamamlayıb və onlar üçün din olaraq İslam dinindən razı olub…"[523] əl-Kuleyni iki ayrı isnad ilə Cəfər əs-Sadiq'dən rəvayət edir ki, əl-Həsən bin Raşid ondan soruşur: "Sənə fəda olum, müsəlmanların iki bayramdan başqa bir bayramı varmı? Dedi: "Bəli, ey Həsən, ən əzəmətlisi və ən şərəflisi." Dedim: "O hansı gündür?" Dedi: "O, möminlərin əmirinin - saləvatullahi va sələmuhu aleyhi - insanlar üçün bir hidayət rəhbəri təyin olunduğu gündür." Soruşdum: "Sənə fəda olum, həmin günü nə etməmiz lazımdır?" Dedi: "Oruc tutursan, ey Həsən! Muhəmmədə və ailəsinə salavatları çoxaldırsan və onlara zülm edənlərdən bəraət edirsən, çünki peyğəmbərlər - salavatullahi aleyhim - öz vasilərinə (sonuncu) vasinin qaim olacağı günü bayram etməklərini əmr edərdilər." Soruşdum: "O gün oruc tutana nə düşür?" Dedi: "Altmış ayın orucu."[524] Şiələrdə bu gün tutulan orucun savabı haqqında fərqli xəbərlər gəlib; bəzi xəbərlərdə bu günün orucu gördüyümüz kimi altmış ayın orucuna bərabər tutulur, bəzi xəbərlərdə bu ayların sayı səksəndir,[525] başqa bir rəvayətdə o gün edilən əməlin "altmış ilin

[521] ət-Tabətabəi, "Təfsirul-Mizən", 6/43;

[522] əl-Mufid, "əl-İrşad", 1/175;

[523] əs-Saduq, "əl-Əməli", səh: 187-188;

[524] əl-Kuleyni, "əl-Kəfi", 4/148-149; Bu barədə həmin bölmədə iki rəvayətə yer verir və əl-Məclisi "Miratul-Uqul" kitabında (16/364-366) hər iki hədisin zəif olduğunu deyir.

[525] "Savabul-Aməl", səh: 99;

əməlindən daha fəzilətli" olduğu qeyd olunur.[526] Daha bir rəvayətdə isə ümumiyyətlə "dünyanın ömrü qədər əməl edənin" savabı yazılır.[527] Şiə alimi Yusuf əl-Bəhrani - şiələrdə formalaşmış bir adət olaraq - bu günün orucu haqqında gəlmiş xəbərlərə də mütəvatir hökmü verir.[528] Şiələr hətta bu gün üçün xüsusi bir namaz da təsis ediblər və onu müstəhəb namazlar sırasında qeyd edirlər. Zəval vaxtından - yəni zöhr girmədən - yarım saat əvvəl iki rükət namaz qılırlar; hər rükətdə fatihədən sonra on bir dəfə ixlas surəsini, on dəfə ayətul-kursini və qədr surəsini oxuyurlar. Şeyx Saduq yazır ki, "Ğadir Xum gününün namazına və o gün oruc tutana düşən savaba gəldikdə isə şeyximiz Muhəmməd ibn əl-Həsən - radiyallahu anhu - bunu səhih saymazdı…və həmin şeyxin səhih saymadığı hər bir şey, səhih saymadığı xəbərlər bizə görə də səhih deyildir, tərk edilmişdir."[529] Buna baxmayaraq əs-Saduq'dan sonra gələn şiə alimləri bu namazı müstəhəb namaz olaraq qəbul ediblər. Şiələrdə "muhaqqiq" ləqəbi ilə tanınan Nəcmuddin əl-Hilli "əl-Mutəbər" adlı kitabında rəvayətin isnadındakı ravinin "aşırılıq" ilə tənqid olunduğunu qeyd etsə də yenə də o rəvayətlə əməl edir və namazı müstəhəb namazlar arasında qeyd edir.[530] Çox qəribədir ki, bu cür dinə yeni ibadətlər daxil edən şiələr, təravih namazını, duha namazını bidət hesab edirlər.

Şiə qaynaqları Gadir Xum hadisəsinin əhəmiyyətini artırmaq üçün orada iştirak edənlərin çoxluğu barədə mübaliğələr edirlər. Bunu ya rəqəmləri süni şəkildə çox göstərməklə, ya da zəvvarların izlədikləri yollar haqqında doğru olmayan məlumatlar verməklə edirlər. Misal üçün Seyyid Cəfər Murtəda əl-Amili bu yerin coğrafi əhəmiyyəti haqqında yazır: "Ğadir Xum yeri Cuhfə məntəqəsindədir ki, bura yolların ayrıldığı yerdir; buradan misirlilərin, mədinəlilərin və iraqlıların yolları ayrılır."[531] Abdulhuseyn əl-Əmini də qeyd edir ki, bura əl-Cuhfəyə aiddir "ki, burada mədinəlilərin, misirlilərin və iraqlıların yolları bölünür."[532] Bu sözləri əl-Əmini məhz Ğadir Xum haqqında

---

[526] "əl-Xisal", 1/264 (rəq: 145); əs-Saduq, "Mən Lə Yəhduru əl-Fəqih", 2/90 (rəq: 1817)

[527] ət-Tusi, "Təhzibul-Əhkəm", 3/143;

[528] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira fi Əhkəm əl-İtratit-Tahira", 13/362;

[529] əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", 2/90-91;

[530] əl-Muhəqqiq, "əl-Mutəbər fi Şərh əl-Muxtəsar", 2/373; Həmçinin bax: əş-Şəhid əl-Əvval, "Zikra əş-Şia fi Əhkəm əş-Şəria", 4/281-282; əl-Bəhrani, "əl-Hədəiq ən-Nadira", 10/535-536;

[531] əl-Amili, "əl-Ğadir val-Muaridun", səh: 14; Darus-Sira, Beyrut, 1417;

[532] əl-Əmini, "Fi Rahəb əl-Ğadir", səh: 38; Darul-Haqq, Beyrut, 1414

yazdığı və şiələrin “ensiklopediya” adlandırdıqları 11 cildlik böyük bir araşdırmasında deyir. Bu da özlüyündə bu hadisənin şiələr nəzərindəki əhəmiyyətini göstərir və Əlinin fəziləti ilə bağlı başqa hansısa tarixi məqam haqqında bu cür mürəkkəb israf olunmayıb. Muhəmməd ər-Reyşəhri hətta yazır ki, “çünki bu yer Mədinəyə, İraqa, Şama və Misirə aparan yolların qovşağı idi və insanlar (orada) öz vətənlərinə üz tutaraq Allahın elçisindən - salləllahu aleyhi va əlih - ayrıldılar, buna görə də Əliyə əmr etdi ki, qarşıda gedənləri qaytarsın və geridə qalanları gözləsinlər.”[533] Digər şiə kitablarında da bu yerin əhəmiyyəti üzərində vurğu etmək üçün buna yaxın sözləri təkrarlayırlar. Lakin Misir, Şam, İraq torpaqları o zaman müsəlmanlara aid ərazilər deyildi və yalnız xəlifə Ömər bin əl-Xattab'ın zamanında bu ərazilər müsəlmanların kontroluna keçdi. Oralardan həccə gələn müsəlmanlar olsa da onların sayları əhəmiyyət kəsb etməyəcək dərəcədə az idi. Üstəlik İraq əhlinin miqatı Cuhfə olmayıb; onların və nəcdlilərin miqatı Məkkənin şimal-şərqindəki Zatu İrq deyilən yerdədir; İraqa dönmək istəyənlərin Qırmızı dəniz sahili boyunca Cuhfəyə tərəf getməkləri mənasız idi. Beləliklə də bu yerdə durmağın səbəbi kimi bu yerin zəvvarların yollarının ayrıldığı yer kimi göstərmək təlbisdir, oxucuları aldatmaqdır.

O gün peyğəmbərin - aleyhissalətu vassələm - xütbəsinə qulaq asanların sayı ilə bağlı şiə kitablarına baxdığımızda daha bir mübaliğə ilə qarşılaşmış oluruq. Misal üçün İbrahim Xazim əl-Amili yazır ki, o gün orada olanların sayı “yüz mindən çox idi. Yüz iyirmi min olduğu deyilib…”[534] “Dəlilul-Vilayə va Durratul-Hidəyə” kitabının müəllifləri də onların sayının yüz iyirmi min olduğunu yazırlar.[535] Bəzi şiə müəlliflər bu sayı iki yüz min nəfər olaraq göstərməyə çalışırlar. Hətta şiə alimi Muhəmməd İbrahim əl-Muvahhid yazır ki, səhabələrin Əliyə “beyəti üç gün çəkdi, çünki bu qədər çoxluqda insanın bir saatda və ya bir gündə beyət etməsi mümkün deyildi.”[536] Gördüyümüz kimi şiələr mümkün olduğu qədər sayları artırırlar və bunun arxasındakı səbəbi anlamaq çətin deyildir; çünki bu günün əhəmiyyətini gücləndirməyə ehtiyac duyurlar. Lakin azca yaxından incələmə bizə bu sayın imkansız olduğunu göstərir. Çünki biz bilirik ki, ağac altında beyət edənlərin sayı təxminən min dörd yüz və ya min beş yüz nəfər idi. Muslimin “əs-Sahih” kitabındakı rəvayətdə Əbuz-Zubeyr Cabir bin Abdilləh'dən belə

---

[533] ər-Reyşəhri, “Məvsuatul-İmam Əli bin Əbi Talib fil-Kitəb vas-Sunnəti vat-Tarix”, 2/387;

[534] əl-Amili, “əl-Ğadir fil-Quran”, səh: 75; Darul-Məhəccətil-Beyda,

[535] “Dəlilul-Viləyə va Durratul-Hidəyə”, 14/166;

[536] əl-Muvahhid, “Əli fil-Əhədis ən-Nəbəviyyə”, səh: 119; Muəssəsə əl-Vafə, Beyrut, 1404

dediyini rəvayət edir: "Hudeybiyyə günü min dörd yüz nəfər idik..." Sonrakı rəvayətdə peyğəmbərin - aleyhissalətu vassələm - əlindən səhabələrinə su tökməsi ilə bağlı hadisədə Səlim bin Əbil-Cəd deyir: "Cabir bin Abdilləh'dən ağac altında olanların sayını soruşdum. Dedi: "(Sayımız) yüz min olsaydı (su yenə də bizə) bəs edərdi, min beş yüz idik."[537] Bir başqa rəvayətdə Huzeyfə deyir: "İnsanlardan İslamı qəbul edənlərin sayını mənim üçün sayın, beləliklə də biz min beş yüz kişi saydıq.." əl-Ayni bu hədisin şərhində deyir ki, "bu söz xəndək qazılarkən deyilib."[538] Ona görə də vəda həccindən Mədinəyə qayıdanların sayının iki yüz min olması, heç yüz iyirmi min olması inandırıcı deyildir. Əhlüs-sünnət qaynaqlarında Mədinə və ətrafındakı müsəlmanların sayının maksimum otuz min olduğu keçir. əs-Səxavi yazır: "əl-Əburi "əl-Mənaqib" kitabında və əs-Səci (öz kitabında) İbn Abdilhəkəm kanalı ilə əş-Şafi'dən belə dediyini rəvayət edirlər: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfat edərkən müsəlmanların sayı altmış min idi: otuz min Mədinədə, otuz min ərəb qəbilələri və başqalarından idi." Həmçinin əl-Beyhəqi'nin (kitabında) İbrahim bin Əli ət-Təbəri yolu ilə Əhməd'dən rəvayətində o deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfat edəndə arxasında otuz min nəfər namaz qıldı." Sanki bununla Mədinəni qəsd etdi."[539] Bu bizə Mədinədə olan səhabələrin sayını xəbər verir və təbii ki, onların hamısı Ğadir Xumda iştirak etmirdi. Şiə kitabları içində bununla bağlı daha inandırıcı rəqəmlər verənlər də vardır. Misal üçün əl-Amili yazır: "əl-Ayyəşi təfsir kitabında Safvan əl-Cəmməl'dən – bir hədisdə - rəvayət edir ki, dedi: Əbu Abdilləh (aleyhissələm) dedi: "Ğadirdə on iki min nəfər iştirak etdi ki, Əli bin Əbi Talibə şahidlik edirdilər, bununla belə öz haqqını ala bilmədi..." Növbəti xəbərdə isə deyir: "Ömər bin Yeziddən; dedi: Əbu Abdilləh – aleyhissələm – dedi: "Əli bin Əbi Talibin qarşılaşdığı hal nə qədər də qəribədir! Onun on min şahidi var idi, öz haqqını almağı bacarmadı, halbuki içimizdən biri öz haqqını iki şahidlə ala bilir." əl-Amili özü bu saya bir izahat gətirməyə çalışır və deyir: "Ola bilsin ki, on min nəfər Mədinədə iştirak edənlər olublar, geridə qalanlar isə öz ölkələrinə ayrılıblar..."[540] Ola bilsin ki, əl-Amili üçün orada iştirak edənlərin sayının azlığını qəbul etmək ağır gəlib, ona görə də hansısa

---

[537] "Sahih Muslim", 1856

[538] əl-Ayni, "Umdətul-Qari Şərh Sahih əl-Buxari", 14/306;

[539] əs-Səxavi, "Fəthul-Muğis bi Şərh Əlfiyyətil-Hədis", 4/110; Məktəbətus-Sunnə, Misir, 1424

[540] əl-Amili, "Təfsil Vasəil əş-Şiə", 27/238; Muəssəsətu Əl əl-Beyt, 1438;

yollarla rəvayətlərə düzəliş etməyə çalışır. əs-Sistani'nin riayəti altında Mustafa İslami Araşdırmalar Mərkəzinin hazırladığı "Əyətul-Ğadir" kitabında yazılır: "Vəda həccində iştirak edənlərin sayı rəvayətlərin bəzilərində yüz mindən yüz iyirmi minə qədər idi, lakin bu say Arafə və Minada idi... Amma həcc tamamlandıqdan sonra bölündülər; onlardan Məkkə əhli olanlar Məkkəyə qayıtdılar, onlardan vətənləri Taif yolundan olanlar var idi ki, o yola yönəldilər, digərləri isə öz ölkələrinə Ciddə yolu ilə döndülər... Allahın elçisi – salləllahu aleyhi va əlihi – ilə birlikdə Cuhfə və Mədinə yolunda olanlar isə minlərlə idilər, çox idilər... təxminən on min nəfər idilər."[541] Şiələrdə göstərilən bu rəqəm daha inandırıcıdır.

Yaxud da istifadə olunan daha bir üslub həmin yerin durmaq üçün uyğun bir yer olmadığını oxuculara aşılamaqdır. Misal üçün Abdullah bin Əhməd əl-Bəhrani deyir: "O məkan dayanmaq üçün münasib deyildi, çünki suyu və otlağı yox idi..."[542] Hicri onuncu əsrin şiə alimlərindən İbrahim bin Süleyman əl-Qatifi yazır: "Cuhfə'dən üç mil əvvəl yerləşən Xum vadisinə çatdığında... Cəbrayıl ona Allahu Təalənin bu sözləri ilə nazil oldu: "Ey peyğəmbər! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan" (5:67) (Peyğəmbər) Cəbrayıldan Mədinəyə qədər möhlət istədi, buna cavab olaraq dedi ki, Allah - subhənəhu va təalə - sənə Əlinin vilayətini bu insanlar öz ölkələrinə və şəhərlərinə ayrılmadan əvvəl bu durduğunuz yerdə fərz etməni əmr edir. Beləliklə də peyğəmbər - salləllahu aleyhi va əlihi - orada dayanmağı, qabaqda gedənlərin qaytarılmasını əmr etdi. Suyu və otu olmadığı üçün dayanılmayan bir yerdə, istirahət etmək üçün yararlı olmayan bir yerdə dayandı və istiliyin şiddətinə görə dayanmağa heç yararlı olmayan bir vaxtda dayandı..."[543] Ondan da əvvəl şiələrin ən böyüklərindən olan əl-Mufid "əl-İrşad" kitabında yazırdı: "Allahın elçisi - salləllahu aleyhi va əlihi - həcc ayinlərini başa vurduqda Əlini - aleyhissələm - öz qurbanına şərik etdi və Mədinəyə yola düşdü; o və müsəlmanlar da onunla idilər. Ğadir Xum adı ilə tanınan yerə gəlib çatdı və burası o zaman dayanmaq üçün uyğun bir yer deyildi, çünki su və otlaq yox idi... Həmin yerdə dayanmağının səbəbi bu idi ki, ona özündən sonra Əlini ümməti

---

[541] "Əyətul-Ğadir: Bəhs fi Xutabi Həccətil-Vadə va Təfsir Əyətil-Ğadir", səh: 226; əl-Mustafa, 1419

[542] əl-Bəhrani, "əl-Ğadir", səh: 54; Dar Hifz ət-Turas əl-Bəhrani, Nəcəf, 1424

[543] əl-Qatifi, "əl-Firqatun-Nəciyə", səh: 86; Darul-Mələk, Beyrut, 1420

arasında xəlifə təyin etməklə bağlı vəhy nazil oldu…”[544] əl-Mufid’in sözlərini əl-İrbili “Kəşful-Ğummə” kitabında eyni şəkildə zikr edir. Muhsin əl-Əmin əl-Amili də bunun bənzərini qeyd edir və hərarətin şiddətini də xatırladır.[545] Şiə alimlərdən buna bənzər sitatlar gətirməklə bu sətrləri uzatmaq mümkündür. Bütün bu drama və mənzərənin ağırlaşdırılması cəhdləri yalnız bir məqsədə xidmət edir. Peyğəmbər - aleyhissalətu vassələm - könüllü olaraq, öz istəyi ilə elə çətin və şəraitsiz bir yerdə dayanmadı, lakin həddindən artıq zəruri bir səbəb onu o yerdə dayanmağa məcbur etdi. Bu adi bir səbəb ola bilməzdi, mütləq dinin ən ağır fərzlərindən bir fərzin elan edilməsi ilə əlaqəli olmalı idi. Çünki sadəcə müstəhəb olan işlərdən ötrü minlərlə müsəlmana o istidə, o quraqlıqda əziyyət vermək halal olmazdı. Bütün bunları yalanlayan isə budur ki, “Ğadir Xum” suyun və ağacların olduğu bir yer idi və orada dayanmağın təbii səbəbləri var idi. Bunun ən başında onu qeyd edə bilərik ki, bəli, əl-Cuhfə tərəf çox isti və quraq bölgələrdir, lakin Cuhfənin bir hissəsi olan Ğadir Xum dayanıb istirahət etmək üçün bölgədə ən əlverişli yerdir, çünki orada - şiə alimlərinin iddialarının əksinə - bol su və yaşıllıq var. əl-Qadi İyad (vəf. h. 544) deyir: “Ğadir Xum, bunu “xa” hərfində zikr etdik və bu, bir vadidir ki, orada bulaq axır və vadi ilə bulaq arasında peyğəmbərə aid bir məscid vardır.”[546] Əbu Abdilləh Muhəmməd bin Abdilhəqq əl-Yəfurani ət-Tilmisəni (h. 536-625) yazır: “Ğadir Xum əl-Cuhfə’dən üç mil aralıdır, yolun solundadır. Bu ğadirdə/vadidə bir bulaq axır, ətrafında hər tərəfi saran çoxlu ağaclar var və bura “xum” adlanan kiçik meşəlikdir…”[547] İbnul-Cəvzi deyir: “əl-Cuhfə’dən bir mil əvvəl Ğadir Xum vadisi gəlir və bu vadi(nin suları) dənizə tökülür, orada mərx, darı və arak’dan başqa bir şey bitmir. Ğadir Xumu heç zaman su tərk etmir, yağış suları həmişə var. Orada Xuzəə və Kinənə qəbilələrindən insanlar var.”[548] Bu deyilənlər öz təsdiqini hədislərdə tapır. Zeyd bin Ərqam deyir ki, “Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfa həccindən qayıtdıqda Xum vadisində dayandı, kölgəliklərin təmizlənməsini əmr etdi…” Daha sonra peyğəmbərin - aleyhissələm - xütbəsini zikr edir və hədisi rəvayət

---

[544] əl-Mufid, “əl-İrşad fi Mərifəti Hucəcilləhi aləl-İbəd”, 1/174-175; Muəssətu Al əl-Beyt, Beyrut, 1429;

[545] Bax: əl-İrbili, “Kəşful-Ğummə”, 1/237; əl-Amili, “Naqdul-Vaşiah əv əş-Şiə beynəl-Haqaiq val-Əvhəm”, səh: 138-139; Muəssəstul-Alə lil-Mətbuat, Beyrut, 1403

[546] əl-Qadi İyad, “Məşəriqul-Ənvar alə Sihəh əl-Əsər”, 2/143;

[547] ət-Tilmisəni, “əl-İqtidab fi Ğarib əl-Muvatta va İrab aləl-Əbvab”, 1/363; Məktəbətul-Ubeykən, 2001

[548] İbnul-Cəvzi, “əl-Muntəzam fi Tarix əl-Muluk val-Uməm”, 1/146;

edən Əbut-Tufeyl deyir: "Zeydə dedim: "Sən bunu özün Allahın elçisindən - salləllahu aleyhi va səlləm - eşitdin?" Dedi: "Kölgəliklərdə elə bir nəfər yox idi ki, onu öz gözü ilə görməsin və qulaqları ilə eşitməsin."[549] Bir başqa hədisdə Zeyd bin Ərqam deyir ki, "Allahın elçisini - salləllahu aleyhi va səlləm - günəşdən qorumaq üçün Səmura ağacına paltar qoyub kölgə düzəldildi…"[550] Zöhr namazını qılması üçün "Allahın elçisi - salləllahu aleyhi va səlləm - üçün iki ağacın altı təmizləndi…"[551] Bütün bunlardan belə bir nəticə çıxarmaq olar ki, şiələrin dedikləri kimi peyğəmbərin Ğadir Xumda dayanması, məcburiyyətdən doğmayıb, əksinə dayanmaq üçün uyğun bir yer olduğu üçün orada dayanıb.

Təəccüb doğuran tərəf budur ki, hədislər arasında şiələrin Əlinin imamlığı və vilayəti üçün ən güclü və ən etibarlı hesab etdikləri dəlil əslində bunun əksini isbat edən ən güclü dəlillərdən biridir. Ğadir Xum hadisəsi öz məzmunu və xüsusiyyətləri ilə isbat edir ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - orada özündən sonra kimisə xəlifə təyin etməyib və heç kimdən beyət almayıb. Bunu bir neçə yöndən görmək mümkündür. Bunlardan birincisi iddia olunan bu hadisənin Xum vadisində baş verməsidir. Nə üçün məhz orada baş verib? əl-Mufid bununla bağlı yazır: "Allah bilirdi ki, əgər Ğadir Xumu keçərlərsə xeyli sayda insan ondan ayrılıb öz vətənlərinə dağılacaqlar, ona görə də möminlərin əmiri Əlinin - aleyhissələm - təyin olmasını onlara eşitdirmək üçün onları orada toplamaq istədi ki, onlara qarşı hüccəti gücləndirsin."[552] əl-Mufid'in sözlərini əl-İrbili "Kəşful-Ğummə" kitabında və əl-Məclisi "Bihərul-Ənvar"da mənasını təsdiqləyərək gətirirlər. Başqa cür desək əl-Mufid qəbul edir ki, Əlinin vilayətinin elan olunması üçün çox sayda insanın buna şahidlik etməsi lazım idi və Ğadir Xum belə bir elanın edilməsi üçün ən uyğun yer idi, əks təqdirdə şahidlərin sayı azalacaqdı. O zaman ortaya təbii bir sual çıxır ki, nə üçün peyğəmbərimiz - aleyhissalətu vassələm - belə önəmli bir fərzi Məkkədə elan etmədi?! Axı iddia budur ki, İslamın ərkanları içində ən əzəmətlisi vilayətdir. Xatırlayaq ki, Şərif əl-Murtəda qeyd edir ki,

---

[549] ən-Nəsəi, "əs-Sunən əl-Kubra", 8092; Bu həmçinin onu göstərir ki, orada iştirak edənlərin sayı şiələrin iddia etdikləri qədər böyük ola bilməzdi, yoxsa o sayda qalabalığın peyğəmbərin - aleyhissalətu vassələm - xütbəsini eşitməsi mümkün olmazdı.

[550] "Musnəd Əhməd", 32/73 (19325); Şeyx Şueyb hədisin səhih olduğunu, lakin məhz bu rəvayətdəki isnadın zəif olduğunu deyir.

[551] "Musnəd Əhməd", 30/430 (18479); Şeyx Şueyb "sahih li ğayrihi" olduğunu yazır.

[552] əl-Mufid, "əl-İrşad fi Mərifəti Hucəcilləhi aləl-İbəd", 1/175;

imamlar barəsində cahil olmaq Allah barəsində cahil olmaqla eynidir.[553] O zaman soruşmaq lazımdır ki, nə üçün Allahın elçisi - aleyhissalətu vassələm - Məkkədə ikən yüz mindən çox müsəlmana bu fərzi bəyan etmədi və onları imamlar barəsində cahil buraxdı?! Həcc bitdikdə yəmənlilər, taiflilər, nəcdlilər öz ölkələrinə doğru yola düşdülər, məkkəlilər Məkkədə qaldılar və onların heç biri Ğadir Xum'dakı xütbəni eşitmədilər. Axı onlar peyğəmbərin öz ağzından Əlinin vilayəti barəsində Allahın fərzini eşitməyiblərsə bu barədə necə xəbər tutmalı idilər?! Nə üçün peyğəmbərimiz on minlərlə müsəlmanı "dinin ən əhəmiyyətli fərzindən" məhrum etdi?! Nə üçün özü Məkkədə təbliğ etmək imkanı olduğu halda bunu təbliğ etməyib və Ğadir-Xumda iştirak edənlərə təbliğ etməyi vacib görüb?! Nə üçün Məkkədə daha çox şahid qarşısında bu fərzi bəyan etmək imkanı olduğu halda - şiələrin iddia etdiklərinə əsasən - çox ağır və əziyyət dolu şərtlərdə insanları qaynar günəşin altında, susuz şəraitdə xütbə dinləməyə məcbur etdi?! Bu fərzin Məkkədə nazil olduğunu, lakin peyğəmbərin - aleyhissalətu vassələm - bu fərzi təbliğ etməkdə tərəddüd etdiyini demək peyğəmbəri öz risaləsini qüsurlu təbliğ etməkdə ittiham etməkdir. Çünki şiələr özləri də deyirlər ki, imamı tanımaq və ona itaət etmək fərzdir və bir fərzi yerinə yetirmək üçün tələb olunan biliklərin təbliğ edilməsi də fərzdir. Dinimizdə şiələr tərəfindən də qəbul edilmiş qaydaya əsasən "bəyanı ehtiyac vaxtından sonraya saxlamaq caiz deyildir." Şübhəsiz ki, Məkkədə olan müsəlmanların Rəblərinin onların üzərinə qoyduğu ən son mükəlləfiyyətdən, ən son fərzdən xəbər tutmağa ehtiyacları var idi, əks təqdirdə bu mükəlləfiyyətin haqqını verə bilməzdilər və əgər biz Allahın elçisinin - aleyhissələm - vəda həccindən təxminən iki ay sonra vəfat etdiyini nəzərə alarsaq o zaman peyğəmbərin böyük bir qüsur işlətdiyini deməyimiz lazımdır. Ya bunu söyləməliyik, ya da peyğəmbərə - aleyhissalətu vassələm - Məkkədə ikən belə bir fərzin nazil olmadığını deməliyik. Ona görə də bəzi şiələr deyirlər ki, Məkkədə bunu təbliğ etməyə ehtiyac yox idi, buna ehtiyac beş gün sonra Ğadir Xum'da ortaya çıxdı. Zeydi şiələrdən Əli bin Saləh ət-Təbəri yazır: "Allahın elçisinin - salləllahu aleyhi va səlləm - ona vəhy olunan hökmlərin hamısının və ya bir hissəsinin bəyanını ehtiyac vaxtına qədər gecikdirməsi əqlən mümkündür… və üstəlik bu baş verib və bir şeyin baş verməsi onun caizliyindən qaynaqlanır, beləki rəvayət olunub ki, ona - salləllahu aleyhi va səlləm - vəda həccində möminlərin əmiri

[553] əl-Murtəda, "ər-Rasəil val-Məsəil", 3/219-220; Muəssəsətut-Tabi van-Nəşr, Məşhəd, 1442

Əlinin vilayəti ilə bağlı nass əmr olunduqda o, Cəbrayıla dedi: "O zaman Qureyş mənim başımı kəsər." Buna görə də bunu Ğadir Xuma qədər gecikdirdikdə, o zaman Cəbrayil bu ayə ilə onun yanına nazil oldu: "Ey Peyğəmbər, sənə Rəbbindən nazil olanı təbliğ et!" Buna görə də şiddətli yorğunluq olduğu halda çox güclü isti havada durdular…" Kitabı təhqiq edən Doktor əl-Murtəda bin Zeyd əl-Məhatvari əl-Həsəni bu sözlərlə bağlı bir haşiyəyə çıxır və yazır: "Bu rəvayətin səhih olduğunu düşünmürəm, çünki Allahın elçisi - salləllahu aleyhi va səlləm - güclü bir məqamda idi və artıq şirkin başını kəsmiş idi, bütləri qoparmışdı və bu, Qureyşin müqəddəslərinin ən müqəddəsləri idi. Ərəblər ona tabe olmuşdular, Qureyş onun ayaqları altında əzilmişdi, Məkkənin fəthində onlara minnət etdi və onları "tuləqa" (azad olunmuşlar) adlandırdı. O zaman onun başını kəsəcək kəslər kimlər idi?! Rəvayətdəki uydurma əlamətləri çox aşkardır və onun - salləllahu aleyhi va səlləm - mütəvatir olaraq sabit olmuş "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" sözü kifayət edir."[554] Gördüyümüz kimi ət-Təbəri deyir ki, ehtiyac vaxtına qədər gecikdirmək olar, lakin yenə də təsdiq edir ki, ehtiyac olduğu halda ondan sonraya gecikdirmək olmaz. Çox təəccüblüdür ki, necə olur ki, Ğadir Xumda ehtiyac yaranır, amma Məkkədə o ehtiyac olmur?! Çox qəribədir, görəsən Ğadir Xumu Məkkədən ayıran xüsusiyyət nədir ki, həmin xüsusiyyətə görə ehtiyac Məkkədə yox məhz orada ortaya çıxır?! Görəsən xüsusi nə baş verdi ki, peyğəmbər - aleyhissalətu vassələm - bu ehtiyacın olduğunu hiss etdi?! Şiələr əlbəttə ki, deyirlər ki, məhz bu yerdə Allahdan peyğəmbərinə təhdid gəldi, artıq bəyanı gecikdirməmək əmr olundu. Biz də deyirik ki, elə tutarsız olan məqam da məhz budur, yəni əgər əl-Mufid'in "məntiqli izahı" doğrudursa, yəni Ğadir Xumu təbliğ üçün uyğun edən yer oradakı şahidlərin çoxluğudursa o zaman Məkkə bunun üçün qat-qat daha münasib yer idi, çünki Məkkədə peyğəmbərin - aleyhissalətu vassələm - xütbəsini ən azından on dəfə daha çox insan dinləyirdi. Əgər peyğəmbər - aleyhissalətu vassələm - məkkəlilərdən, yəmənlilərdən, nəcdlilərdən, taiflilərdən Əli bin Əbi Talibə beyət alsaydı o zaman tarixin gedişi fərqli ola bilərdi. Üstəlik tarixin gedişinini bir kənara qoysaq, daha önəmli olan bir məsələ hələ də cavabsız qalır: yuxarıda qeyd etdiyimiz kimi müsəlmanların bilməsi fərz olan bir məsələ nə üçün onlara bəyan olunmadı? Peyğəmbər - aleyhissələm - çox gözəl bilirdi ki, vəda

[554] ət-Təbəri, "Şifə əl-Ğalil əs-Səil ammə Təhamməlahu əl-Kəfil", səh: 410; Məktəbətu Bədr, Sana, 1436

həccində qarşısında duran on minlərlə müsəlmanı növbəti il görməyəcək və onlar da onu görməyəcəklər, buna görə də onlarla vədalaşdı. ən-Nəsai və başqaları rəvayət edir ki, Cabir bin Abdilləh deyir: "Allahın elçisini - salləllahu aleyhi va sələm - dəvəsinin üstündə ikən Cəmaratda daş atdığını gördüm və deyirdi: "Ey insanlar, (məndən) həccin əhkamını öyrənin, çünki mən bilmirəm, ola bilsin ki, bu ildən sonra bir daha həcc etmədim." Bir başqa rəvayətdə isə "bəlkə də bu ildən sonra sizi görməyəcəm" deyir.[555] Həmçinin Muaz bin Cəbəl rəvayət edir ki, "Allahın elçisi - salləllahu aleyhi va səlləm - onu Yəmənə göndərərkən onunla birlikdə (Mədinənin xaricinə) çıxdı ki, ona tövsiyə versin. Bu zaman Muaz minik üzərində idi və Allahın elçisi - salləllahu aleyhi va səlləm - miniyin yanında yürüyürdü. Dedi: "Ey Muaz, çox ehtimal ki, sən məni bu ildən sonra bir daha görməyəcəksən. Ola bilsin ki, (qayıdanda) mənim bu məscidimin və qəbrimin yanından keçəcəksən." Bunun üzərinə Muaz Allahın elçisindən - salləllahu aleyhi va səlləm - ayrıldığına görə ağlamağa başladı. Sonra (peyğəmbər) geriyə döndü və Mədinəyə tərəf baxdı və dedi: "Şübhəsiz ki, insanlar içində mənə ən yaxın olanlar kim və harada olmaqlarından asılı olmayaraq təqva sahibləridirlər."[556] On minlərlə müsəlmana həccin əhkamını öyrədərkən onlarla vidalaşan peyğəmbərimiz - aleyhissalətu vassələm - necə olur ki, dinin - iddiaya görə - ən əzəmətli və ən ağır fərzini təbliğ etməkdən çəkinir?! Axı Allah məhz onu insanlara təbliğ edici və xəbərdar edici olaraq göndərmişdi. Təbii ki, vəfatından sonra Əbu Bəkr seçildikdə həcdə peyğəmbərin - aleyhissalətu vassələm - vəda həccini dinləmiş on minlərlə müsəlman da Əbu Bəkri peyğəmbərin xəlifəsi və möminlərin əmiri olaraq qəbul etdilər, əgər Allahın elçisi - salləllahu aleyhi va səlləm - onlara Əlinin özündən sonra imam olduğunu, tək və haqq xəlifə onun olduğunu desəydi onlar Əbu Bəkrin xəlifəliyini təsdiq etməzdilər, məcbur olsalar da bəlkə qəlblərində Əlinin imamlığını etiraf edərək "qurtulardılar." Nə üçün peyğəmbərimiz onlara bu imkanı tanımadı?! Əlbəttə ki, təcəhülü-arif qəbilindən olan bu sualların cavabı da aydındır; peyğəmbərimiz - aleyhissələm - Ğadir Xumda özündən sonra heç kimi xəlifə təyin etməmişdi.

Bu hədisdə önəmli olan daha bir nöqtə təbliğin özü ilə bağlıdır. Şahid olduğumuz kimi şiələrin təqdim etdikləri xəbərlərdən aydın olur

---

[555] "Sünən ən-Nəsai", 5/270 (3062); "Musnəd Əhməd", 23/205 (14946); Şeyx Şueyb isnadının İmam Muslimin şərtlərinə görə səhih olduğunu deyir.

[556] "Musnəd Əhməd", 36/376 (22052); Şeyx Şueyb isnadının səhih olduğunu yazır.

ki, Əlinin vilayəti Məkkədə nazil olmuşdu, lakin peyğəmbər - aleyhissalətu vassələm - təbliğ məqamında, yüz mindən çox müsəlmanın qarşısında bu fərzi təbliğ etməmiş, təxir etmişdi. Daha sonra Ğadir Xum adlı yerdə Allahu təalə peyğəmbərinə bu ayəni nazil edir və onu təhdid edir: "Ey Peyğəmbər! Rəbbindən sənə nazil ediləni təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan. Allah səni insanlardan qoruyacaqdır. Şübhəsiz ki, Allah kafir qövmü doğru yola yönəltməz."[5:67] Əgər bu ayədə təbliğ olunması tələb olunan məsələ Əlinin vilayətidirsə, o zaman buradan zəruri olaraq ortaya çıxan nəticə budur ki, peyğəmbər - aleyhissalətu vassələm - Əlinin vilayətini daha əvvəl təbliğ etməmişdi. Belə bir nəticə şiələrin öz iddialarını rədd edir, çünki şiələr iddia edirlər ki, peyğəmbər - aleyhissələm - Əlinin vilayətini daha əvvəl həm ona nazil olan Quran vasitəsi ilə, həm də sünnəsində təbliğ etmişdi. İddia edirlər ki, Allah Maidə surəsində "Sizin vəliniz ancaq Allah, Onun peyğəmbəri və iman gətirənlərdir, o kəslər ki, namaz qılırlar və rüku halında zəkat verirlər" dediyində bu ayə ilə Əlinin peyğəmbərdən - aleyhissələm - sonra bütün möminlərin vəlisi, əmiri, imamı olduğunu bəyan etmiş olur. Əgər bu doğrudursa deməli Allah - tabərakə va təalə - artıq Əlinin vəliliyini Quran ayəsi ilə təbliğ etmişdi və peyğəmbər də - salləllahu aleyhi va səlləm - bunu insanlara vaxtında çatdırmışdı; yəni iddiaya görə müsəlmanlar vəda həccindən də əvvəl hər dəfə bu ayəni oxuduqda Allah onlara peyğəmbəri vasitəsilə Əlinin vilayətini təbliğ etmiş olurdu. Həmçinin iddia edirlər ki, hələ Məkkədə dəvətinin əvvəlində peyğəmbər - aleyhissalətu vassələm - öz əmilərini, əmisi uşaqlarını evinə çağırmış və onlara Əlinin özündən sonra möminlərin vəlisi olduğunu təbliğ etmişdi. Yenə iddia edirlər ki, Allahın elçisi isra və meracdan gəldikdən sonra Əlinin vəlayəti barəsində meracda ikən təyinatın gəldiyini səhabələrinə xəbər vermişdi. Yenə iddia edirlər ki, Tabuk döyüşünə gedərkən peyğəmbər - salləllahu aleyhi va səlləm - Əlinin ona nisbətini Harunun Musaya olan nisbəti ilə eyniləşdirərək Əlinin özündən sonra xəlifə olduğunu bəyan etmişdi. Belə anlaşılır ki, əgər şiələr doğru deyirlərsə o zaman peyğəmbər Əlinin vilayətini artıq dəfələrlə həm Quran vasitəsilə, həm də sünnət vasitəsilə təbliğ etmişdi. O zaman Allah - azzə va cəllə - nə üçün peyğəmbərini təhdid edərək "Rəbbindən sənə Əlinin vilayəti barəsində nazil ediləni təbliğ et, əgər bu fərzi təbliğ etməsən risalətin tamamını təbliğ etməmiş olacaqsan" deyir?! Təsəvvür edin ki, dostum mənə bir əmanəti sahibinə çatdırmağı tapşırır və mən əmanəti sahibinə çatdırdıqdan sonra dostum məni "əmanəti sahibinə çatdır" deyərək təhdid edir. Məgər belə bir əbəs və

mənasız bir şey aləmlərin Rəbbinə yaraşdırıla bilərmi?! Burada etiraf edilməlidir ki, ya təbliğ ayəsindən əvvəl peyğəmbər - aleyhissalətu vassələm - Əlinin vilayəti haqqında heç bir şeyi təbliğ etməmişdi, ya da etmişdi. Əgər birincinin doğru olduğunu desək belə anlaşılacaq ki, "rüku halında zəkat verənlər" ayəsi ilə Əlinin vəliliyi qəsd olunmur və həmçinin "Allaha, elçisinə və sizdən olan əmr sahiblərinə itaət edin!" əmri gəldikdə əmr sahibləri ilə başda Əli olmaqla imamlar qəsd olunmurdu. Çünki necə ola bilər ki, Allah peyğəmbərinə bu cür ayələr endirsin, lakin peyğəmbərimiz - aleyhissalətu vassələm - bu ayələrdə qəsd olunan mənanı müsəlmanlara bəyan etməsin?! Ya da deməyimiz lazımdır ki, bu ayələrdə qəsd olunan Əlinin vilayəti idi və peyğəmbər - aleyhissalətu vassələm - üzərinə düşən vəzifəni yerinə yetirmişdi, müsəlmanlara bu ayələrdəki mənaları bəyan etmişdi. O zaman təbliğ ayəsində qəsd olunanın Əlinin vilayəti olmadığını deməyə məcburuq.

**Ğadir** hədisinin şiələrin kitablarında rəvayət olunduğu versiyasının doğru olmadığını göstərən digər dəlil budur ki, dinin kamil olması haqqındakı ayə Ğadir Xum deyilən yerdə yox, vəda həccində Arafada ikən nazil olmuşdu. İbn Abbas deyir: "Bu ayə Arafa günündə, cümə günü nazil oldu."[557] Bir başqa rəvayətdə yəhudilərdən biri Ömərin yanına gəlir və deyir: "Ey möminlərin əmiri, siz kitabınızda elə bir ayə oxuyursuz ki, o əgər biz yəhudilərə nazil olsaydı o günü bayram edərdik." Dedi: "O hansı ayədir?" Dedi: "Bu gün sizin üçün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım…" Ömər bunun üzərinə dedi: "Allaha and olsun ki, mən bu ayənin Allahın elçisinə - salləllahu aleyhi va səlləm - nazil olduğu günü və nazil olduğu vaxtı bilirəm; cümə günündə Arafa gecəsi."[558] Həmçinin Muhəmməd ibn əl-Hənəfiyyə vasitəsilə rəvayət olunur ki, Əli bin Əbi Talib deyib: "Allahın elçisinə - salləllahu aleyhi va səlləm - Arafədə ikən axşam vaxtı nazil oldu."[559] əs-Suddi deyir: "Bu ayə Arafa günü nazil olub."[560] əş-Şabi deyir: "Bu ayə Allahın elçisi - salləllahu aleyhi va səlləm - Arafadə ikən nazil oldu."[561] Sufyan əs-Səvri deyir: "Arafa günündə, bir cümə günü nazil olub."[562] Bu ayənin Ğadir Xum günü nazil olması ilə bağlı sünnət

---

[557] "Musnəd Əbi Davud ət-Tayəlisi", 4/428 *2832); ət-Tirmizi (3044) və isnadı səhihdir.

[558] "Musnəd Əhməd", 1/320 (188); Şeyx Şueyb isnadının əl-Buxari və Muslim şərtlərinə görə səhih olduğunu yazır. "Sahih əl-Buxari", 45, 4145, 4330, 6840; Muslim, 3017

[559] ət-Tahavi, "Şərh Muşkil əl-Əsər", 6/308 (2501);

[560] "Təfsir ət-Təbəri", 9/518;

[561] "Sunən Said bin Mənsur", 4/1438 (713) İsnadı səhihdir. "Təfsir ət-Təbəri", 2/34;

[562] "Təfsir Sufyan əs-Səvri", səh: 99;

əhlinin kitablarında keçən rəvayətlərə gəldikdə isə bu rəvayətlərin heç biri səhih deyildir. Bu rəvayətlərdən birində Əbu Hureyra'dan belə dediyi rəvayət olunur: "Kim zul-hiccə ayının on səkkizi oruc tutarsa Allah - azzə və cəllə - ona altmış ayın orucunu(n savabını) yazar və o gün Ğadir Xum günüdür ki, o vaxt Allahın elçisi - salləllahu aleyhi va səlləm - Əli bin Əbi Talib'in əlini tutdu və dedi: "Mən möminlərin mövlası deyiləmmi?" Dedilər: "Bəli, ey Allahın elçisi." Əlinin əlindən tutaraq dedi: "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır." Ömər bin əl-Xattab ona dedi: "Bəh, bəh, ey Əbu Talibin oğlu! Mənim və bütün müsəlmanların mövlası oldun." (Əbu Hureyra) dedi: "Bunun üzərinə Allah - təbərakə va təalə - bu ayəni endirdi: "Bu gün sizin dininizi tamamladım." [5:7]"[563] Bu rəvayətin heç isnadına nəzər salmadan[564] bunun bir uydurma olduğunu, bir yalançı tərəfindən uydurulmuş və düşünülməmiş bir yalan olduğunu başa düşmək mümkündür. Bunun ən aşkar səbəbi budur ki, İslam dinində Quranda və səhih sünnətdə sabit olmuş ən fəzilətli oruc ramazan ayının orucudur və məlumdur ki, ramazan ayının orucu on ayın savabına bərabərdir. Üstəlik dinin tamamlanması haqqındakı ayənin Arafə günündə nazil olması da sabitdir. Buna görə də alimlərimiz bu hədisin uydurma olduğunu, yalan olduğunu deyiblər. əl-Curqani deyir: "Bu hədis

---

[563] "Fəvaid İbn Əxi Mimi", səh: 217 (468); "Tarixu Bağdad", 9/221 (Bəşşər) ;

[564] Hədisin isnadına gəldikdə bunun yalnız bir isnadı vardır. Əli bin Said ər-Ramli rəvayət edir; Damra bin Rabia əl-Quraşi bizə İbn Şəvzəb'dən, o da Mətar əl-Varraq'dan, o Şəhr bin Həvşəb'dən, o da Əbu Hureyra'dan rəvayət edir. Şəhr bin Həvşəb haqqında ixtilaf edilib: Əbu Zura ər-Razi, Əhməd bin Hənbəl, Yəhya bin Main onu etibarlı saydığı halda Şubə, Əbu Hatim ər-Razi, Yəhya bin Said əl-Qattan, İbn Adiyy onun hədisinin hüccət olmadığını deyiblər. ən-Nəsəi, əl-Beyhəqi, əd-Dəraqutni, Musa bin Harun əl-Həmməl, İbn Həzm onu zəif hesab ediblər. Mətar bin Tahmən əl-Varraq'a gəldikdə isə Əbu Bəkr əl-Bəzzar, Əbu Hatim ər-Razi, Əbu Zura, İbn Main, Əhməd bin Saleh əl-Cili onun hədisdə saleh olduğunu desələr də əksəriyyət onu zəif hesab ediblər. İbn Adiy, Əbu Davud, ən-Nəsəi, əd-Dəraqutni, İbn Sad onun zəif olduğunu deyirlər, əl-Buxari onun "munkər əl-hədis" olduğunu deyir. Bu isnadda bir də Əli bin Said bin Quteybə var və o, isnadın əsas bağıdır, hamı hədisi ondan rəvayət edir. İbn Zureyq "Mən Təkəlləmə Fihi əd-Dəraqutni" kitabında (2/93) qeyd edir ki, əd-Dəraqutni onun zəif olduğunu deyib. əz-Zəhəbi həm "Mizənul-İtidəl" kitabında, həm də "əl-Muğni fid-Duafə" kitabında onun haqqında "halı araşdırılmalıdır, sanki saduqdur" yazır. Onu zəif ravilər siyahısına salır, lakin "sanki saduqdur" deyir. "Divanud-Duafə" kitabında isə (səh: 283; rəq: 2930) onun haqqında "kim olduğu araşdırılmalıdır" yazır, onu zəiflər arasına salır. Görünür ki, əz-Zəhəbi onun halını bilmir, məchul olduğu üçün zəif ravilər sırasına salıb. İbn Həcər isə "Lisənul-Mizən" kitabında xəta edərək onu Əli bin Əbi Həmlə ilə eyniləşdirir və buna görə onu siqa sayır. Əslində əz-Zəhəbi bu ikisini fərqli ravilər olaraq qeyd etməkdə doğru edib, çünki Əli bin Əbi Həmlə isnadlarda hər zaman Damra bin Rabia'nın şeyxi olaraq gəlir, yəni Damra hər zaman ondan hədis rəvayət edir. Amma Əli bin Said bin Quteybə ər-Ramli isə əksinə həmişə isnadda Damra'nın tələbəsi kimi qeyd olunur.

batildir."[565] İbnul-Cəvzi deyir: "Bu hədisi hüccət edinmək icazəli deyildir… ayənin isə Arafa günü nazil olmasında heç bir şəkk yoxdur, bu iki "əs-Sahih"də zikr olunur."[566] İmam əz-Zəhəbi deyir: "Bu, münkər bir hədisdir, səhih deyildir. Bu ayənin arafa günü Arafada nazil olduğu sabit olub və müəyyən olaraq bu günün orucunun heç bir fəziləti yoxdur; bu necə ola bilər ki, halbuki rafizilər bu günü bayram hesab edirlər və onu qeyd edirlər?! Bu hədisi kimin uydurduğunu bilmirəm."[567] İbn Kəsir isə deyir: "Bu, çox münkər bir hədisdir, hətta yalandır. Çünki iki "əs-Sahih" kitabda Ömər bin əl-Xattab'dan sabit olub ki, bu ayə bir cümə günü arafada Allahın elçisinin - salləllahu aleyhi va səlləm - o dağda durduğu zaman nazil olub. Həmçinin onun "zül-hiccə ayının on səkkizinin orucu - və bu, Ğadir Xum günüdür - altmış ayın orucuna bərabərdir" deməsi də səhih deyildir, çünki bütün ramazan orucunun on aya bərabər olması mənası "əs-Sahih"də sabit olub, o zaman necə olur ki, bir günün orucu altmış aya bərabər olsun?!" Bu batildir."[568] Təfsir alimi əl-Alusi də deyir ki, "bu, çox münkər bir hədisdir."[569] Bununla bağlı gəlmiş digər rəvayət barədə isə əs-Suyuti deyir: "İbn Mərdəveyh və İbn Asakir zəif sənədlə Əbu Said əl-Xudri'dən belə dediyini rəvayət edirlər: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - Ğadir Xum günü Əlini təyin edib onun vilayətini elan etdikdə Cibril ona bu ayəni nazil etdi: "Bu gün sizin dininizi kamil etdim.."[570] əs-Suyuti özü isnadın zəif olduğunu yazır və əslində o, çox yumşaq hökm verir. Bu rəvayət uydurmadır.[571] Əhlüs-sünnət kitablarında bu barədə

---

[565] "əl-Əbatil val-Mənakir vas-Sihah val-Məşəhir", 2/367 (714);

[566] "əl-İləl əl-Mutənəhiyə fil-Əhədis əl-Vahiyə", 1/223 (356);

[567] "Risalətu Turuq Hədis Mən Kuntu Məvləhu fə Aliyyu Məvləhu", səh: 82;

[568] "əl-Bidəyə van-Nihəyə", 7/680-681; ət-Turki

[569] "Təfsir əl-Alusi", 3/361;

[570] əs-Suyuti, "əd-Durrul-Mənsur fit-Təfsir bil-Məsur", 3/19; Darul-Fikr, Beyrut

[571] Uydurma olduğunun sübutu isnadındakı ravilərdir. Bu hədisi Yəhya bin Abdulhəmid əl-Həmməni, Qeys bin ər-Rabi'dən, o Əbu Harun əl-Abdi'dən, o da Əbu Said əl-Xudri'dən rəvayət edir. Əbu Harun əl-Abdi haqqında İbn Həcər "Lisənul-Mizən" kitabında (7/487) deyir: "Əbu Harun əl-Abdi, basralıdır, adı Ammərа bin Cuveyn'dir… şiədir, tərk olunmuş ravidir, onlardan kimisi yalançı olduğunu deyiblər." Onun yalançı olduğunu əl-Buxari, Yəhya bin Main, İsmail bin Uleyyə, İbrahim əl-Cəvzəcəni, İbn Zeyd əl-Cəhdəmi, Osman bin Əbi Şeybə onun yalançı olduğunu deyiblər. əl-Uqeyli "əd-Duafə" kitabında (1/58) Şubə bin əl-Həccac onunla bağlı deyib: "Boynumun vurulması mənim üçün "Əbu Harun əl-Abdi mənə rəvayət etdi" deməkdən daha sevimlidir." Qeys bin ər-Rabi haqqında isə alimlər ixtilaf ediblər, lakin əksəriyyət onun xətalar etdiyini, bəzən münkər xəbərlər rəvayət etdiyini, bunun isə yaşlandıqdan sonra hafizəsinin zəifləməsi ilə bağlı olduğunu deyiblər. Yəhya bin Abdilhəmid əl-Həmməni isə haqqında ixtilaf edilmiş biridir, hətta yalanda ittiham edənlər olub.

səhih və ya mötəbər heç bir şey yoxdur və təfsir alimləri bu məsələdə ixtilaf nəql etmirlər. Şiə kitablarına gəldikdə isə əl-Kuleyni "əl-Kafi" kitabında isnadı ilə Muhəmməd əl-Baqir'in belə dediyini rəvayət edir: "Sonra vilayət əmri nazil oldu və bu, peyğəmbərə cümə günü Arafada gəldi və Allah nazil etdi: "Bu gün sizin üçün dininizi kamil etdim və sizə olan nemətimi tamamladım…"[572] Ona görə də bəzi şiə alimləri aradakı problemi həll etmək üçün deyirlər ki, "Allahın (maidə) surəsinin əksərini, o cümlədən "bu gün dininizi kamil etdim" ayəsini və onunla birlikdə vilayət əmrini Arafə günündə nazil etməsi, peyğəmbərin isə vilayəti bəyan etməyi Ğadir Xuma qədər gecikdirməsi mümkündür…" Bu sözlərin sahibi şiə təfsir alimi ət-Tabətabəi davamında izah edərək deyir: "Bu ayənin tilavəti Arafa günündə idi, amma bəzi rəvayətlərdə bu ayənin Ğadir günü nazil olmasına gəldikdə isə, peyğəmbərin vilayət əmrini təbliğ etməklə əlaqədar olaraq bu ayəni (yenidən) tilavət etməsi də uzaq ehtimal deyildir, çünki onunla bağlıdır."[573] Əslində ət-Tabətabəi burada problemi həll etmiş olmur, əksinə daha bir ziddiyyətə düşür. Çünki ayə Arafa günü nazil olubsa, Allahın elçisi - aleyhissalətu vassələm - insanlara artıq dinin kamil olduğunu həmin gün elan edibsə və bu münasibətlə onlara Əlinin vilayətini bəyan etməyibsə, buradan yalnız bir məna çıxır və Arafa günündəki müsəlmanlar yalnız bu mənanı başa düşüblər. Bu məna isə budur ki, bu ayədən sonra müsəlmanlara hansısa yeni bir fərz və ya qadağa nazil ola bilməz. Təsəvvür edin ki, peyğəmbərin - aleyhissalətu vassələm - sonuncu həccində onun sözünü eşitmiş yəmənlilər, məkkəlilər, taiflilər, nəcdlilər daha sonra hansısa şiədən peyğəmbərin Əlinin vilayətini fərz qılması haqqında bir xəbər eşitdikdə bunu təsdiqləyə bilərmi?! Halbuki dinin kamil olması ayəsini öz qulaqları ilə Arafa günü Allahın elçisindən eşitmişdi. Təbii ki, bu müsəlmanlar belə bir "yeniliyi" qəbul etməyəcəkdilər və rədd edəcəkdilər və həqiqətdə də bu hasil oldu. Əgər şiələrin iddiaları doğrudursa bu, peyğəmbərə və onun peyğəmbərlik vəzifəsinə qarşı ağır bir ittihamdır.

Təbliğ ayəsinə gəldikdə isə hər şeydən əvvəl deməliyik ki, ayənin məzmunu bizə ayəni doğru anlamaqda kömək edir. Ona görə də Maidə surəsində bu ayələrin keçdiyi məzmuna baxmağımız lazımdır. Allahu təalə buyurur: "Yəhudilər: "Allahın əli bağlıdır!" - dedilər. Dediklərinə görə öz əlləri bağlansın və lənət olsun onlara! Əksinə, Onun əlləri açıqdır, istədiyi kimi sərf edər. Rəbbindən sənə nazil edilən (Quran)

---

[572] əl-Kuleyni, "əl-Kafi", 1/290; əl-Məclisi isnadının zəif olduğunu yazır.

[573] ət-Tabətabəi, "əl-Mizən fi Təfsir əl-Quran", 5/196-197;

şübhəsiz, onlardan bir çoxunun azğınlığını və küfrünü artırır. Biz, qiyamət gününə qədər onların arasına düşmənçilik və kin saldıq. Onlar müharibə üçün hər dəfə od qaladıqlarında (fitnə-fəsad çıxardıqlarında), Allah onu söndürmüşdür. Onlar yer üzündə fitnə-fəsad törətməyə çalışırlar. Allah isə fitnə-fəsad törədənləri sevməz.[64] Əgər kitab əhli iman gətirib (pis əməllərdən) çəkinsəydilər, həqiqətən, onların günahlarının üstünü örtər və özlərini də Nəim (neməti bol olan) cənnətlərinə daxil edərdik.[65] Əgər onlar Tövrata, İncilə və Rəbbindən özlərinə nazil edilənə (Qurana) əməl etsəydilər, üstlərində və ayaqları altında olanlardan (yerüstü və yeraltı sərvətlərdən) yeyərdilər. Onların içində mötədil (orta yolu tutan) bir camaat da var. Ancaq onlardan çoxunun gördüyü işlər necə də pisdir![66] Ey Peyğəmbər! Rəbbindən sənə nazil edilənі (Quranı) təbliğ et! Əgər bunu etməzsən, Onun risalətini təbliğ etməmiş olarsan. Allah səni insanlardan qoruyacaqdır. Şübhəsiz ki, Allah kafir qövmü doğru yola yönəltməz.[67] De: "Ey kitab əhli! Tövrata, İncilə və Rəbbinizdən sizə nazil edilənə (Qurana) əməl etməyincə bir şey (doğru yol) üzərində olmazsınız!" Rəbbindən sənə nazil edilən (Quran) onlardan bir çoxunun azğınlığını və küfrünü artıracaqdır. Ona görə də kafir qövm üçün kədərlənmə![68]

Bəqərə surəsində Allah - cəllə cələluhu - peyğəmbərinə deyir: "Əgər sənə gələn elmdən sonra onların istəklərinə uysan səni Allahdan qoruyan nə bir dost, nə də bir köməkçi tapılar."[2:120] Yenə eyni surədə buyurur: "Əgər sənə gələn elmdən sonra onların arzularına uysan, o zaman sən zalımlardan olarsan."[2:145] Allahın bu ayələrdə peyğəmbərinə - aleyhissalətu vassələm - bu şəkildə xitab etməsi onun batində yəhudilərə və ya nəsranilərə uymaq, onlara tabe olmaq istəyinin olduğuna dəlalət etməz. Əhzab surəsində Allah - azzə va cəllə - buyurur: "Ey Peyğəmbər! Allahdan qorx, kafirlərə və münafiqlərə itaət etmə! Həqiqətən, Allah hər şeyi biləndir, hikmət sahibidir."[33:1] Necə təsəvvür etmək olar ki, peyğəmbər kafirlərə və münafiqlərə itaət etmək istəmişdi və Allah buna görə onu təhdid edib?! Ona görə də əl-Bəqilləni təbliğ ayəsi barəsində yazır: "Bu, Allahın peyğəmbərinin - salləllahu aleyhi - halından onun təbliği və endirdiyini aşkardan elan etməyi tərk edəcəyini bildiyini gərəkdirməz..."[574] əz-Zərkəşi də qeyd edir ki, "peyğəmbər - salləllahu aleyhi va sələm - ona nazil olanı təbliğ etmişdir, beləliklə də burada təbliğə davam etməsi əmr olunur..."[575]

[574] əl-Bəqilləni, "əl-İntisar lil-Quran", 2/451;

[575] əz-Zərkəşi, "əl-Bəhr əl-Muhit", 4/321;

Təbliğ ayəsinin nazil olma səbəbi və zamanı haqqında dəqiq məlumat yoxdur. İbn Atiyyə təfsirində bununla bağlı yazır: "Muhəmməd bin Kab əl-Qurazi dedi: "Allah səni insanlardan qoruyacaq" ayəsi, peyğəmbəri - salləllahu aleyhi va səlləm - öldürmək üçün onun qılıncını götürmüş bədəvi haqqında nazil olub." İbn Atiyyə daha sonra qeyd edir ki, həmin bədəvinin adı Ğavras bin əl-Haris idi və bu hadisə Zatur-Riqa döyüşündə olub.[576]

Təbliğ ayəsinin Əli bin Əbi Talib ilə heç bir əlaqəsi yoxdur. Ona görə də əl-Alləmə əl-Hilli'nin "Minhəcul-Kəramə" kitabında ayənin "Əli haqqında nazil olması üzərində ittifaq edilib" deməsi[577] bir yalandır. Bu barədə İbn Əbi Hətim ər-Razi'nin təfsir kitabında Atiyyə əl-Avfi'nin Əbu Said əl-Xudri'dən rəvayət etdiyi xəbər də[578] səhih deyildir, çünki isnadında zəif olan Əli bin Abis və Atiyyə əl-Avfi kimi ravilər var.[579] Hətta bəzi şiələr inanırlar ki, təbliğ ayəsi nazil olarkən orada Əlinin adı və vilayəti qeyd edilirdi. Şiə rəvayətlərinə inanmalı olsaq təbliğ ayəsi Quranda səhabələr tərəfindən təhrif olunmuş ayələrdən biridir. əl-Qummi təfsirində Qurandan "təhrif olunmuşlar"a misal verərkən deyir: "Ey Peyğəmbər! Sənə Rəbbindən Əli haqqında nazil olanı təbliğ et. Əgər etməzsən Risaləni təbliğ etməmiş olarsan."[580] Bütün bunlar bir daha bizə şiələrdən bir qrup arasında Quranın təhrif olunması inancının nə üçün yayıldığını göstərmiş olur; çünki ortaya atdıqları iddialar əlimizdəki Quran tərəfindən heç bir dəstək tapmadıqda, əksinə istər tərtib, istər məzmun, istərsə də ləfzlərin dəlaləti baxımından Quran bu iddiaları yalanladığı üçün onun təhrif olunduğunu iddia etməli oldular.

---

[576] "Təfsiru İbn Atiyyə", 2/218;

[577] əl-Hilli, "Minhəcul-Kəramə", səh: 117;

[578] Bax: "Təfsir İbn Əbi Hətim", 4/1172 (rəq: 6609); Məktəbətu Nəzzər; (Dar İbn əl-Cəvzi çapında 5/173)

[579] əl-Bərzəi'nin "əs-Suələt" kitabında (2/429 əl-Haşimi) müəllimi Əbu Zura ər-Razi nəql edir ki, Əli bin Abis haqqında deyib: "Hədisləri münkərdir; siqa olan bir qrup ravidən çox sayda münkər xəbərlər rəvayət edir." Atiyyə əl-Avfi isə şiəliyi və zəifliyi ilə tanınıb. İbn Hibban onun haqqında danışarkən yazır: "Əbu Said əl-Xudri'dən hədislər eşitdi, Əbu Said ölən kimi əl-Kəlbi'nin məclislərində iştirak etməyə və onun hekayələrinə qulaq verməyə başladı. Əgər əl-Kəlbi "Allahın elçisi belə dedi" deyərsə onu əzbərləyərdi və onu Əbu Said kunyəsi ilə çağırar, ondan rəvayət edərdi. Ondan "bunu sənə kim rəvayət edib?" soruşulduqda "mənə bunu Əbu Said rəvayət edib" deyərdi, insanlar da elə düşünərdilər ki, bununla Əbu Said əl-Xudri'ni qəsd edir, halbuki bununla əl-Kəlbi'ni qəsd edirdi. Ona görə də onun xəbərlərini dəlil götürmək, nə də onun hədisini yazmaq halal deyildir. Əgər yazılacaqsa yalnız üzərində təəccüb etmək üçün yazılar." (əl-Məcruhin, 2/176; Darul-Vay)

[580] "Təfsir əl-Qummi", 1/30; Muəssəsətul-İməm əl-Mehdi

Əgər şiələrin kitablarını doldurduğu xəbərlərə inanmalı olsaq deməliyik ki, Əlinin imamlığı, xəlifəliyi hələ daha əvvəldən nazil olmuşdu. İddiaya görə merac hadisəsində Allah öz peyğəmbərinə Əlinin "sonuncu peyğəmbərin özündən sonra buraxacağı ilk xəlifə olduğunu" vəhy etmişdi.[581] Rəvayətlərdən anlaşılan budur ki, peyğəmbərimiz - aleyhissalətu vassələm - bunu öz səhabələrinə təbliğ etmişdi.

## Mövla sözü

Rəvayətimizin maraqlı olan digər hissəsi isə peyğəmbərimizin - aleyhissalətu vassələm - seçdiyi sözlərlə bağlıdır. Şiələrin rəvayətləri və alimlərinin sözləri ilə tanış olduq. Beləliklə də iddia etdiklərinə görə Allah Əlinin imamətini, vilayətini peyğəmbərinə Məkkədə ikən nazil etmişdi, lakin peyğəmbər tərəddüd etmiş, qorxmuş, kimlərdənsə ehtiyat etmiş və bunu bəyan etməyi gecikdirmişdi. Daha sonra Ğadir Xum adlı yerə çatdıqlarında Allahdan təhdid və vaid nazil olmuş, peyğəmbərini təhdid etmiş və ona Əlinin vilayətini gecikdirmədən təbliğ etməyi əmr etmişdi. Şiə alimi Muhəmməd əs-Səbzəvari deyir ki, peyğəmbər "insanların bunu öz əmisi oğlunda ayrıseçkilik etmək kimi başa düşəcəklərindən qorxurdu və səhabələrindən bir qrupun bunu qəbul etməsinin çətin olacağından ehtiyat edirdi. Lakin Rəbbinin - azzə ismuhu - təhdidi onu daha çox qorxutdu..."[582] Bütün bu tərəddüd və təxirdən sonra aləmlərin Rəbbindən gələn təhdid qarşısında peyğəmbər - aleyhissalətu vassələm - məşəqqətli şərtlər altında dayanmalı olur, insanları günəşin altında toplayır, xütbə verir və xütbəsində Əlinin özündən sonra xəlifə olduğunu bəyan etməyə çalışır və bunun üçün bu sözləri işlədir: "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır." Burada problem budur ki, "mövla" sözü ərəb dilində çox mənalı bir sözdür və Quranda keçən mövla və vəli sözləri "hami", "köməkçi", "dost", "sevilən" mənalarındadır. Ənfal surəsində buyurur: "Əgər onlar üz döndərsələr,

---

[581] əl-Məclisi, "Biharul-Ənvar", 36/86; ər-Reyşəhri, "Məvsuatu əl-İmam Əli bin Əbi Talib", 8/96;

[582] əs-Səbzəvari, "əl-Cədid fi Təfsir əl-Quran əl-Məcid", 2/497; Darut-Təaruf, Beyrut, 1402

bilin ki, Allah sizin himayədarınızdır (mövlanızdır). O nə gözəl himayədar (mövla) və nə gözəl yardımçıdır!"[8:40] Həcc surəsində deyir: "O, zərəri faydasından daha yaxın olana dua edir. Onun dua etdiyi nə pis köməkçi (mövla), nə pis yoldaşdır."[22:13] Bir başqa ayədə deyir: "Çünki Allah iman gətirənlərin himayədarıdır (mövlasıdır). Kafirlərin isə heç bir himayədarı (mövlası) yoxdur."[47:11] Duxan surəsində isə dost mənasında deyir: "O gün dostun dosta (mövlanın mövlaya) heç bir faydası olmayacaq və onlara heç bir köməklik də göstərilməyəcəkdir."[44:41] Mövla sözü Nisa surəsində varis mənasında işlədilib: "Hər kəs üçün valideynlərin və yaxın qohumların qoyub getdiklərindən varislər (mövlalar) təyin etdik."[4:33] Nəhl surəsində ağa, seyyid, sahib mənasında gəlir: "Allah eləcə də iki kişi barəsində məsəl çəkdi; Onlardan biri laldır, heç bir şeyə gücü çatmır və öz ağasına (mövlasına) yükdür."[16:76] Əhzab surəsində mövla sözü yaxın insan mənasında keçir və oğulluğa götürülən uşaqlarla bağlı buyurur: "Onları öz atalarının adları ilə çağırın! Allah nəzdində bu daha ədalətlidir. Əgər onların atalarının kim olduğunu bilmirsinizsə, onları din qardaşlarınız və yaxınlarınız (mövlalarınız) olaraq görün!"[33:5] Məryəm surəsində isə Zəkəriyyanın dili ilə "mövla" sözü əmi oğulları, qohum-əqrəba mənasında və "vəli" sözü oğul mənasında işlədilib: "Mən özümdən sonra gələn qohum-əqrəbamdan qorxuram. Zövcəm də qısırdır. Ona görə də Öz tərəfindən mənə bir oğul ver!"[19:5] Mövla sözü o qədər geniş mənalı və istifadəsi şaxəli sözdür ki, onu kölə öz ağası üçün, ağa isə öz köləsi üçün istifadə edə bilirdi. Mövla sözü "azad edilmiş qul" mənasını verdiyi kimi, "himayəyə götürülmüş insan" mənasını da verə bilirdi. Ərəb qəbilələri İslama daxil olmuş qeyri ərəblərə "himayə" və "müttəfiqlik" imkanı verərək onları öz qəbilələrinə qoşurdular, beləliklə də onlar həmin qəbilələrə "mövlalar" olaraq nisbət olunurdular. Bütün bu misallar bizə "mövla" sözünün çoxmənalı və mücməl olduğunu göstərir, bu sözdə tək dəqiq bir məna yoxdur. O zaman oxucular özlərinə belə bir sual verməlidirlər; bütün bu tərəddüdlərdən, təxirlərdən və ilahi təhdiddən sonra Allah elçisinin - salləllahu aleyhi va səlləm - ilahi təyinat üçün seçə biləcəyi ən yaxşı və ən aydın sözlər bunlar idi?! Nə üçün Allahın elçisi - aleyhissələm - fikrini açıq şəkildə ifadə edərək "ey müsəlmanlar, mən öldükdən sonra sizin əmiriniz, hakiminiz, başınızda durub sizin işlərinizi idarə edəcək şəxs Əli bin Əbi Talibdir, ona beyət edin, sözünü eşidin və itaət edin" - demədi? Yoxsa peyğəmbər ilahi təyinat ilə gəlmiş vəhyi Məkkədə ikən on minlərlə müsəlmandan gizlədərək qüsurlu davrandığı kimi bu səfər onu, aydın olmayan bir dillə ifadə edərək yenə qüsura yol vermişdimi?!

Hətta möminlərin əmiri Əli bin Əbi Talib özü ona “mövla” deyərək xitab edildikdə bundan şiələrin qəsd etdikləri mənanı başa düşmürdü. İmam Əhməd “əl-Musnəd” kitabında səhih isnad ilə rəvayət edir ki, Riyəh bin əl-Həris deyir: “Əli Rahbə’də ikən bir qrup insan onun yanına gəldilər və dedilər: “Sənə salam olsun, ey mövlamız!” Dedi: “Ərəb olduğunuz halda necə sizin mövlanız ola bilərəm?!” Dedilər: “Allahın elçisini - salləllahu aleyhi va səlləm - ğadir-xum günü belə deyərkən eşitdik: “Mən kimin mövlasıyamsa bu da onun mövlasıdır.” Riyəh deyir: “Oradan ayrıldıqlarında arxalarınca getdim və kim olduqlarını soruşdum. Dedilər ki, aralarında Əbu Əyyub əl-Ənsari’nin də olduğu ənsardan bir qrupdur.”[583] Əli bin Əbi Talib öz zamanında “mövla” sözünün yayğın olaraq istifadə edildiyi mənanı anlamışdı. Əgər “mövla” sözünün ilk ağla gələn mənası dövlət başçısı, əmir, hakim olsaydı Əlinin ənsardan olanların sözünə təəccüblənməsi üçün bir səbəb olmazdı. İbn Sad “ət-Tabəqat əl-Kubra” kitabında deyir: ““Şəbəbə bin Səvvar əl-Fəzəri bizə xəbər verdi; əl-Fudeyl bin Mərzuq mənə xəbər verdi: “əl-Həsən bin əl-Həsəni onların haqqında aşırılığa varan birinə belə deyərkən eşitdim: “Sizə vay olsun! Bizi Allah üçün sevin! Əgər Allaha itaət etsək bizi sevin, əgər Allaha asi olsaq bizə nifrət edin!” Həmin adam ona dedi: “Siz Allahın elçisinin qohumları və əhli beytisiz.” (əl-Həsən) dedi: “Vay olsun sənə! Əgər Allah kiməsə heç bir itaəti olmadan sadəcə Allahın elçisinə - salləllahu aleyhi va səlləm – qohumluğuna görə fayda versəydi o zaman ona bizdən də daha yaxın olanlara, atasına və anasına fayda verərdi. Allaha and olsun ki, içimizdə ası olana iki qat əzab veriləcəyindən narahatam və içimizdən yaxşı əməl sahibinə isə iki qat əcr veriləcəyinə ümid edirəm. Veyl olsun sizə, Allahdan qorxun və bizim haqqımızda haqqı deyin, bu, istədiyinizə daha tez çatdırar və biz sizdən buna görə razı olarıq.” Sonra dedi: “Əgər sizin bu dedikləriniz Allahın dinindəndirsə o zaman atalarımız bizə həqiqətən pislik ediblər, çünki bizə onları öyrətməyiblər və bizi onlara təşviq etməyiblər.” Həmin rafizi ona dedi: “Məgər Allahın elçisi – aleyhissələm – Əliyə deməyibmi ki, “mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır”? Dedi: “Allaha and olsun ki, əgər bununla əmirliyi və səltənəti qəsd edirdisə o zaman daha aydın şəkildə ifadə edərdi, necəki namazı, zəkatı, ramazan orucunu və Allahın evini həcc etməyi onlara açıq şəkildə öyrədib. O zaman deyərdi: “Ey insanlar, bu, məndən sonra sizin əmr sahibinizdir.” Çünki insanlara ən çox qayğı göstərən kəs Allahın elçisi - salləllahu aleyhi va səlləm – idi. Əgər məsələ sizin

---

[583] “Musnəd Əhməd”, 38/541-542 (23563)

dediyiniz kimi olsaydı, yəni Allah və rasulu Əlini peyğəmbərdən – aleyhissələm - sonra insanlara başçılıq etmək üçün seçmişdisə o zaman Əli özü bu işdə insanlar arasından xətası və günahı ən böyük olandır, çünki Allahın elçisinin – salləllahu aleyhi va səlləm – ona əmr etdiyini əmr etdiyi şəkildə yerinə yetirmədi və ya insanlara bu işdə üzrünü ifadə etmədi."[584] Bu xəbərin isnadı səhihdir.[585] Burada bu sözləri deyən zat əl-Həsən bin əl-Həsən əl-Musənnə bin əl-Həsən əs-Sibt bin Əli bin Əbi Talib'dir. Yəni peyğəmbərin – salləllahu aleyhi va səlləm – reyhan qoxulu nəvəsi Həsənin eyni adlı nəvəsidir. Anası Fatimə bint əl-Hüseyn bin Əli bin Talib'dir, yəni hər iki tərəfdən əhlul-beytdəndir, əhlul-beytin imamlarındandır. İbadəti və zühdü ilə tanınması ilə yanaşı zalımlara qarşı haqq sözünü deməkdən çəkinməzdi. Abbasi xəlifəsi əl-Mənsur onu qardaşları və tələbələrindən bir qrup ilə birlikdə Mədinə şəhərindən götürərək ayaqları qandallı şəkildə İraqdakı Haşimiyyə məhbusxanasına gətirib orada həbs edir. Hicri 145-ci ildə o həbsdə 68 yaşında vəfat edir. Ona görə də Şihəbuddin əl-Alusi bu nöqtəyə toxunaraq deyir: "Allahın elçisi insanların ən elmlisi və ən fəsahətlisidir. O, vacib əməlləri ən kamil şəkildə bəyan edib. Bu məsələ dinin təməlidir, o zaman qəsdinin nə olduğunu niyə aşkar şəkildə ifadə etməyib, Allahın bəndələrinə doğrunu göstərib deməyib ki, "ey insanlar, Əli məndən sonra sizin əmr sahibinizdir, sizi idarə edəndir, ona görə də onun sözünü dinləyin və itaət edin!"[586] Peyğəmbərin - aleyhissalətu vassələm - Ğadir Xum adlı yerdə xütbə verərkən işlətdiyi sözlərin Əlinin xilafətinə dəlalət etməsinə gəldikdə sünnət əhli, o cümlədən səhabələr o sözlərdən Əlinin xilafət təyinatını başa düşməyiblər. Hədisdə şiələr tərəfindən iddia olunan mənanın aşkar olmadığının ən böyük dəlili budur ki, imami alimləri özləri hədisdəki "mövla" sözü ilə imamətin qəsd olunduğunu sübut etmək üçün mücəllədlər dolusu mürəkkəb israf edirlər. Bunu sübut etmək üçün hər şeydən əvvəl "mövla" sözünün ən yayğın olan, ən aşkar olan mənalarını həmin məzmunda qəsd olunmadığını isbat etməyə ehtiyac

[584] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 5/319; Dar əs-Sadir

[585] əl-Beyhəqi "əl-İtiqad" kitabında (səh: 355) bunu həm Şəbəbə bin Səvvar, həm də Cəfər bin Aun yolu ilə rəvayət edir. Musab bin Abdilləh əz-Zubeyr "Nəsəbu Qureyş" kitabında (səh: 49) bunu bir başa əl-Fudeyl bin Mərzuq'dan rəvayət edir. əl-Mizzi "Təhzibul-Kəməl" kitabında (6/88) Şəbəbə yolu ilə gələn bu rəvayət haqqında deyir: "Bu, ən səhih və ən qısa isnadlardandır." əl-Fudeyl bin Mərzuq şiə olsa da alimlərimiz onu siqa, saduq hesab ediblər. Bunu ondan rəvayət edən Şəbəbə bin Səvvar, Cəfər bin Aun, Musab bin Abdilləhin hamısı siqadır.

[586] əl-Alusi, "ən-Nəfəhət əl-Qudsiyyə", səh: 79-82;

duyurlar, daha sonra “mövla” sözünün etimoloji olaraq “əvla” (daha layiq) sözü ilə bağlı olduğunu isbat etməli olurlar və üçüncü addım olaraq “əvla” mənasının burada “məhəbbət, sevgi, dostluq, nüsrət” vəsfləri ilə yox, məhz “idarə, təsərrüf” vəsfləri ilə bağlı olduğunu göstərməlidirlər. Bütün bu addımları bir-bir isbat etmədən “mövla” sözündən imamət, xəlifəlik mənasını çıxara bilmirlər.

Peyğəmbərin - aleyhissalətu vassələm - özündən sonra Əlini xəlifə kimi təyin etməsinin aşkar yox, “gizli təyinat” olduğunu deyən zeydilərin böyük alimlərindən əl-Mənsur Billəh Abdullah bin Həmzə imami şiələrinə cavab olaraq yazır: “Çünki biz bilirik ki, imamilərin alimləri və onların arasında söz sahibləri Ğadir və Mənzilə xəbərlərinə, rükuda ikən zəkat vermə ayəsinə əsaslanaraq dəlillər gətirdiklərində bizimlə eyni metodu izləyirlər və bu, onların kitablarından məlumdur; mənanı ortaya çıxarmaq, izahat gətirmək və istidləl etməkdə əsərlər və xəbərlərdə mümkünlüyün ən son həddinə qədər tərcihlər və mübaliğələr edirlər. Əgər (bu xəbərlərdə) qəsd olunan məna - iddia etdikləri kimi - onların nəzdində zəruri olaraq bilinsəydi bu mənanı üzə çıxarmaqda və bəyan etməkdə bütün bunlara ehtiyac qalmazdı. Necəki biz şəriətin zəruri olaraq bilinən təməl məsələlərində bunu etməyə ehtiyac görmürük, misal üçün biz müsəlmanlara namazların sayının beş olduğunu, mallarda zəkatın vacib olduğunu, həccin Allahın evinə tərəf edildiyini və bu ümmətin peyğəmbərinin Muhəmməd - salləllahu aleyhi va əlihi va səlləm - olduğunu isbat etmək üçün dəlil gətirmirik, çünki bu məsələlər zəruri olaraq bilindiyi üçün İslam dininə etiqad edən birinə bunu izah etməyə ehtiyac duymuruq, əksinə onu sadəcə əməl etməyə tərk edirik. Onların əş-Şərif əl-Murtəda əl-Musəvi kimi, ondan əvvəl və sonra gəlmiş kəlam əhlindən olan görkəmli alimlərinin ayənin və xəbərlərin mənasını bəyan etməkdə həddindən çox əziyyətə qatlandıqlarını gördüyümüzdə bilirik ki, onların (iddia etdikləri) zəruri məna, aşmaqda olan bir uçurumun kənarındadır, çünki bir kimsə aşkar olan bir şeyi aşkara çıxarmaq üçün məşəqqətlərə qatlanarsa, boş və mənasız bir iş görmüş olar; artıq üzdə olan bir şeyin nəyini üzə çıxarırsan?!...”[587] Beləliklə də zeydilər deyirlər ki, Ğadir Xum xəbərində və Mənzilə xəbərində aşkar nass yoxdur və imami şiələrin iddia etdikləri aşkar nassı sübut etmək üçün istifadə etdikləri üslublar özlüyündə göstərir ki, məna aşkar deyildir, aşkar olsaydı bu qədər əziyyətə qatlanmazdılar. Şiələrin alimlərindən Nurullah ət-Tustəri (h. 956-1019)

---

[587] əl-Mənsur Billəh, “əl-Aqdus-Səmin fi Əhkəm əl-Əimmətil-Hədin”, səh: 50-51; Muəssəsətu əl-İməm Zeyd bin Əli əs-Səqafiyyə, Amman, 1421

bu irada belə cavab verir: “Onun “peyğəmbərə - salləllahu aleyhi va səlləm - (Ğadir Xumda) sözü gedən xütbədə açıq şəkildə “bu məndən sonra xəlifədir” deməyinə nə mane oldu?” etirazına gəldikdə isə, bu mərduddur, çünki bunun eynisi Allah haqqında da keçərlidir, qoy onda Allahla mübahisə etsin ki, nə üçün möminləri heyrətə salıb və mütləq şəkildə, mücməl olaraq “namaz qılın!” deyib və fərzlərin saylarını, sünnətlərin saylarını, vaxtların nə zaman olduğunu aşkar sözlərlə ifadə etməyib, namazın rükətlərinin sayını, səfərdə və hadarda onu əda etməyin necəliyini bəyan edən bir ayə endirməyib. Əksinə mübhəm bir ifadə ilə “namaz qılın!” deyib ki, Muhəmmədin - salləllahu aleyhi va əlihi - ümmətini heyrətə salsın. Zəkat da eyni üslubla gəlib, nisab həddi müəyyən edilməyib, ona görə də fəqihlər arasında ixtilafa səbəb olub və onları furuatı istinbat etmək üçün rəyə və ictihada möhtac buraxıb və beləliklə də bütün bunlar yetmiş üç firqənin ortaya çıxması ilə nəticələnib. Şəriətin yerdə qalan hökmləri haqqında da eyni şeyi demək olar. Əgər bu cür mücməllik və mübhəmlik ilə Muhəmmədin - sallələllahu aleyhi va əlihi - peyğəmbərliyinin əbəs olmaması mümkündürsə, o zaman peyğəmbərin - sallələllahu aleyhi va əlihi - və ya Allahın imamı təyin edərkən “xilafət” və “imamət” kimi aşkar sözlər yerinə mənadan aydın anlaşılan “təsərrüfdə əvləviyyət” sözünü işlətməsi də mümkündür, hətta bunun mümkünlüyü daha münasibdir, çünki “imamət” məsələsi bizə görə əqli məsələdir, çünki əql sahiblərinin ağlında oturuşub ki, sonuncu peyğəmbərdən sonra, xəta etməsi mümkün olmayan bir imamın olması vacibdir…”[588] ət-Tustəri’nin sözlərini bir qədər analiz etməyimiz lazımdır. Gördüyümüz kimi ət-Tustəri inkar etmir və qəbul edir ki, peyğəmbərimiz - sallələllahu aleyhi va səlləm - Ğadir Xum xütbəsində mücməl və mübhəm sözlər, qapalı ifadələr işlədib. Lakin ət-Tustəri bunu Quranda fərzlərlə bağlı gəlmiş əmrlərlə müqayisə edir. Sonra əlavə edir ki, imamətin vacibiyyətini insanlar bu barədə xüsusi bir əmr olmasa da dərk edə bilirlər və ona görə də bu barədə şəriətin əmrinin mübhəm olması bir zərər verməz. Birinci iddiasına gəldikdə, yəni imaməti namazla və ya zəkatla müqayisə etməyə gəldikdə bu barədə daha əvvəl geniş bir izaha yer vermişik, amma burada yenə fayda üçün bəzi məqamlara toxunmağımız lazımdır. ət-Tustəri’nin bu məsələni namazla və ya zəkatla eyniləşdirməsi batildir, çünki Quranda namaz və ya zəkat haqqında gələn əmrlərin mənaları özlüyündə aydındır; yəni biz anlayırıq ki, Allah bizdən bəlli vaxtlarda namaz qılmağımızı istəyir,

---

[588] ət-Tustəri, “əs-Savarim əl-Muhriqa”, səh: 197-198;

həmçinin anlayırıq ki, mallarımızdan müəyyən bir miqdarı ayırıb Quranda qeyd edilən səkkiz növ insana verməyimizi tələb edir. Bu mənanı anlamaqda heç kim ixtilaf etmir, ona görə də Qurandakı bu əmrlər sarihdir, aşkardır; şiəsindən tutmuş xavaricinə qədər heç kimsə bu mənaları anlamaqda çətinlik çəkmir. Ğadir Xumdakı imamət iddiası isə belə deyildir, çünki peyğəmbərin - aleyhissalətu vassələm - orada özündən sonra kimisə xəlifə təyin etdiyini ümmətin əksəriyyəti başa düşməyib, ümmətin az bir hissəsini təşkil edən şiələr yalnız bu iddianı ortaya atıblar. Üstəlik namaz kimi ibadətin əsli üsulud-dindəndir və bu, Quranın aşkar sözləri ilə sabitdir. Namazların sayına, vaxtlarına, rükətlərinin sayına gəldikdə isə sünnət əhlinin fərqli məktəbləri bu məsələlərdə ixtilaf etməyiblər, əksinə ittifaq halındadırlar, çünki bu məsələlərdə peyğəmbərin bəyanı o qədər aşkardır ki, ixtilaf etməyə yer yoxdur. ət-Tustəri'nin bunları misal göstərməsi uğursuz və ucuz bir cəhddir. Bəzi kiçik təfsilatlara, sünnətlərə gəldikdə isə o məsələlərdə ixtilaf etmək heç kimin imanına zərər verməz, əksinə bu cür ixtilafın olması - sünnət əhlinə görə - şəriət sahibinin məqsədidir. Bu cür furuatın təfsilatında olan ixtilafları heç bir şəkildə imamət ilə müqayisə etmək olmaz, çünki ümmət ittifaq edib ki, furuatın ixtilafında bir kimsə mövcud rəylərdən birinə təqlid edərək əməl edərsə isabət etmiş və savab qazanmışdır. Amma imamət kimi bir məsələyə gəldikdə şiələr imaməti nübuvvətin uzantısı hesab edirlər, nübuvvət ilə bərabərləşdirirlər və bu məsələdə xətanı küfr və ilhad ilə eyniləşdirirlər. O zaman hansı ağıl və hansı məntiqlə namazın furuatındakı təfsilat ilə imamət məsələsini eyniləşdirmək mümkündür?! Bundan əlavə namaz əmri ilə imamət əmri arasındakı ən aşkar fərqlərdən biri budur ki, namaz əməl ilə edilən ibadətdir, təfsilatı çox genişdir, ona görə də onların hamısının Quranda zikr edilməsi mümkün deyildir, əks təqdirdə Quran kitabı oxunması və hifz edilməsi çətin olan bir elmihala çevrilərdi. Namaz əməl ilə bağlı ibadət olduğu üçün müsəlmanlar peyğəmbəri müşahidə edərək bunu öyrəniblər. İmamət isə belə deyildir, çünki imamət mövzusunda imamların məsumluğu, onların qabaqcadan müəyyən edilmiş şəxslər olması kimi önəmli məsələləri bəyan etmək üçün bir-iki ayə kifayət etməli idi və Quranda bunun qeyd olunmaması - şiələrin iddiası işığında - həqiqətən də təəccüblüdür. Daha da təəccüblü olan budur ki, peyğəmbər - aleyhissalətu vassələm - nə vəda həccində Arafada, nə də Ğadir Xumda bunu açıq-aşkar sözlərlə bəyan etmədi. İmamət məsələsinin, xüsusilə də imamın məsum olması və Allah tərəfindən təyin edilmiş olması kimi məsələlərin əqli məsələlər olduğunu iddia etmək isə gülünc bir iddiadır, çünki onsuz da

aramızdakı ixtilaf nöqtələrindən biri budur, çünki əqlə iddialı olan qrupların əksəriyyəti şiələrin bu iddiası ilə razı deyillər, hətta zeydilər belə bu məsələdə onlara müvafiq olmayıblar. Üstəlik tövhid məsələsi əqli məsələlər içində ixtilafsız ən əqli bir məsələdir, lakin bununla belə Quranda tövhid haqqında nazil edilmiş ayələrin çoxluğu ilə başqa heç bir məsələ müqayisə oluna bilməz. Tövhidin əqli bir məsələ olması Quranda onun haqqında bəyanın enməsinə olan ehtiyacı azaltmır, bəs necə olur ki, - əqli olduğu iddia olunan - imamət məsələsində bir dənə də olsun açıq-aşkar nə ayə var, nə də hədis?!

Əgər bu cavab ət-Tustəri'nin cavabıdırsa və burada Ğadir Xum hadisəsindəki məxfilik, mübhəmlik təsdiqlənirsə şiə alimlərindən bəziləri bunu inkar etməyə çalışırlar. Müasir imami şiələrindən Cəfər əs-Subhəni yuxarıda zeydi alimindən nəql etdiyimiz sözlərə cavab olaraq onların "gizli nass" inancının tutarsız olduğunu sübut etmək üçün yazır: "İmamət - şiələrin etiqadına görə - elə təməl məsələlərdəndir ki, orada etibara alınan yalnız (yəqin) elmdir; yoxsa zənn, təxmin, əhəd xəbərlər belə bir məsələdə kifayət etmir. (Yəqin) elm ilə qəsd olunan peyğəmbərdən - salləllahu aleyhi va əlihi va səlləm - sadir olan elmdir. Beləliklə də əgər bu məsələdə yəqinlik, sonra qəlbin möhkəmcə etiqad etməsi tələb olunursa, o zaman bununla bağlı gəlmiş xəbərin aşkar olması, yəqinlik ifadə etməsi gərəkdir: (elə bir xəbər olmalıdır ki,) deyildiyi anda orada iştirak edən və etməyən mükəlləflərin, Qiyamət gününə qədər xitabın çatacağı hər bir kəsin zehnində şəkkə və şübhəyə yer qoymamalıdır. Yoxsa əks təqdirdə bu mövzuda heç bir fayda verməyən zənn və şəkkdən başqa bir nəticə hasil olmayacaq. Başqa cür desək: Əgər Əlinin imamlığını elan etmək peyğəmbərə Allahdan - subhənəhu - verilmiş vacib bir vəzifə idisə o zaman burada iki haldan biri mümkündür: ya peyğəmbər bunu aşkar sözlərlə demək imkanına sahib idi, ya da belə bir imkanı yox idi. Bu ikinci variantı peyğəmbərin həyatı, xüsusilə də onun son qismi; İslamın möhkəmcə qərar tapıb kök atdığı dönəm bunu təsdiqləmir, beləki peyğəmbər qəlbinin tam bir mənada ilahı vəhyi dərk etdiyi zamandan bəri o, itaət olunur və ehtiram görürdü: "Peyğəmbərlər o kəslərdir ki, Allahın göndərdiyi əmrləri təbliğ edər, Allahdan qorxar və Ondan başqa heç kimdən qorxmazlar."[33:39] Bu deyilənlərin işığında məlum olur ki, İmam Əlinin vilayətini aşkar bir təyinat ilə bildirmək, vəfatından sonra insanlara Allahın məhz onu imam təyin etdiyini bəyan etmək peyğəmbərin imkanında idi. O zaman bu aşkar nassı tərk edib gizli nass işlətməsi ümməti parçalanmaya və ixtilaflara məruz qoymaqdır,

münaqişə və konfliktin toxumlarını əkməkdir, halbuki Allah subhənəhu söyləyir: "Hamılıqla Allahın ipinə yapışın və parçalanmayın!"[3:103].."[589] Qəribə səslənsə də biz bu dediklərində Cəfər əs-Subhani ilə razıyıq. Təbii ki, əs-Subhəni burada zeydilərin məzhəbini, onların etiqad etdikləri "gizli nass" inancını çürütməyə çalışır və haqlı olaraq deyir ki, peyğəmbər - aleyhissalətu vassələm - xüsusilə də ömrünün sonunda heç kimdən qorxmurdu, təbliğ məsələlərində heç kimdən çəkinmirdi və Allahın ona tapşırdıqlarını aşkar şəkildə ifadə etmək imkanına sahib idi. Belə bir imkanı olduğu halda aşkar və birmənalı sözlərlə Əlinin imamlığını, xilafətini bəyan etmək yerinə üstü örtülü sözlər işlətməsi, Əlinin təyinatını gizli bir xitab ilə ifadə etməsi ümməti təhlükəli yollara soxmaq, onların ixtilaf etməklərinə, parçalanmaqlarına və konfliktə girməklərinə səbəb olmaqdır. Ona görə də zeydi şiələrinin məzhəbi doğru ola bilməz, peyğəmbər - aleyhissalətu vassələm - gizli nass ilə bu cür önəmli məsələləri təbliğ edə bilməz. Bu məsələdə ya sünnət əhlinin dediyi kimi peyğəmbər - sallələllahu aleyhi va səlləm - heç kimi özündən sonra təyin etməyib, ya da imami şiələrin dedikləri kimi aşkar sözlərlə təyin etmişdir. Bunun ortasında bir şeyin olması doğru deyildir. Ona görə də Cəfər əs-Subhəni inanır ki, ğadir hədisi "Əlinin imamətinə dair ən aşkar dəlillərdəndir." O inanır ki, "bu hadisəyə şahid olanlar peyğəmbərin məqsədinə və demək istədiklərinə heç bir şəkk və tərəddüd olmadan vaqif oldular, lakin peyğəmbər əsrinin üstündən uzun bir vaxtın keçməsi ləfzdəki və məzmundakı qarinaların xeyli hissəsinin itməsinə səbəb oldu…" əs-Subhani'yə görə məhz bu qarinalar peyğəmbərin "məqsədini bəyan etməkdə bir rola sahib idi."[590] Yəni başqa sözlə desək əs-Subhəni iddia edir ki, şiə alimləri kitablarında ğadir hədisinin "aşkar mənasını" üzə çıxarmağa çalışdıqları üçün mürəkkəb sərf edərkən əslində bununla həmin "gizlənmiş" qarinaları üzə çıxarmağa çalışırdılar. Bu nöqtədə isə biz əs-Subhəni ilə yox, zeydi alimi İbn Həmzə ilə və ət-Tustəri ilə razılaşmağımız lazımdır, çünki Ğadir hədisindən bizə mütəvatir olaraq gələn hədislər qarşımızdadır, hədisin ləfzinin özündə aşkar heç bir mənası yoxdur. əs-Subhəni'nin iddia etdiyi qarinalar isə, misal üçün təbliğ ayəsinin Ğadir Xum deyilən yerdə nazil olması, orada iştirak edənlərin sayının çoxluğu, onların isti və susuz bir yerdə dayanmağa məcbur olmaqları

[589] əs-Subhəni, "Buhus fil-Miləl van-Nihəl", 7/415; Muəssəsətu əl-İmam əs-Saduq, Qum, 1428;

[590] Eyni mənbə, 7/417-418;

və digər xəyali qarinalar ya yalandır, ya şişirdilmiş və həqiqi həddindən kənara çıxarılmış, təhrif edilmiş misallardır. əs-Subhani'nin ğadir hadisəsinin aşkar dəlil olduğunu iddia etməsi, gizli nass olduğunu inkar etməsi onun köməyinə gələ bilməz, çünki ğadir hədisinin aşkar yox, məhz gizli nass olması şiələrin keçmiş alimlərinin etiraf etdikləri bir məsələ olub. Misal üçün əl-Murtəda əş-Şərif deyir: "Gizli nassa gəldikdə isə, o, imamətə dəlalətin onun aşkar ləfzində yox, yalnız onun məzmunu və mənasında olduğu naslardır. Misal üçün ğadir xəbəri və təbuk xəbəri."[591] Gördüyümüz kimi şiələrin Aləmul-Hudə ləqəbi ilə ucaltdıqları şiə alimi əl-Murtəda etiraf edir ki, Ğadir Xum xütbəsindəki sözlərdə aşkar məna yoxdur, lakin şiələrin axtardıqları məna o sözlərin məzmununda və məfhumunda gizlənib. Müasir şiələrin bəziləri iddia edirlər ki, bu fikir yalnız əl-Murtəda əş-Şərifə xasdır. Bu, yalandır, əksinə bunu çox sayda şiə alim etiraf edib. Bir başqa şiə alimi, əl-Murtəda əş-Şərif'in mənəvi varisi hesab olunan Əbu Saleh əl-Hələbi (374-447) yazır: "Amma peyğəmbərin – salavatullahi aleyhi – muradının (yalnız) istidlal yolu ilə bilindiyi nassa gəldikdə isə bu, təbuk və ğadir xəbərləridir."[592] Təbuk xəbəri ilə qəsd etdikləri hədis Harunun Musaya nisbətinin Əli ilə peyğəmbər nisbəti haqqındakı hədisdir. Mənanın istidlal yolu ilə bilinməsi o deməkdir ki, bu məna sözün aşkar ləfzindən anlaşılmır, o mənanı üzə çıxarmaq üçün əlavə dəlillərə ehtiyac var. Hicri dördüncü əsrin şiə alimlərindən Əbu İshaq bin Növbəxt ona nisbət olunan "əl-Yaqut" adlı kitabında[593] həm ğadir hədisini, həm də mənzilə hədisini gizli nass olaraq təsnif edir. Həmçinin Muhəmməd Şəriətmədar əl-Əstərabadi də (h. 1197-1263) "ğadir-xum" və "mənzilə" hədislərini gizli nasslar arasında qeyd edir.[594] Eləcədə hicri altıncı əsrin alimlərindən İbn Əbil-Məcd əl-Hələbi də gizli nasslara misal verərkən onların arasında ğadir və mənzilə rəvayətlərini misal verir.[595] Hicri altıncı əsrdə yaşamış bir digər şiə alimi əl-Fədl bin əl-Həsən ət-Təbərsi də gizli naslar haqqında danışarkən "rükuda zəkat" ayəsi ilə yanaşı Ğadir və Mənzilə hədislərini də misal verir.[596] Cəməluddin əl-Kəf'ami "Məaricul-Əfhəm" kitabında ğadir, mənzilə

---

[591] Rasəil əl-Murtəda, 1/339;

[592] Əbu Saləh əl-Hələbi, "Təqribul-Məarif", səh: 205; Faris Təbrizyan, 1417

[593] "əl-Yaqut" adlı kitabın Əbu İshaq İbrahim bin Növbəxtə nisbətində şiə alimləri ixtilaf ediblər.

[594] Şəriətmədar, "əl-Bərahin əl-Qatiah", 3/274;

[595] İbn Əbil-Məcd əl-Hələbi, "İşəratus-Səbq ilə Mərifətil-Haqq", səh: 51-54; Muəssəsətun-Nəşr əl-İsləmi, Qum, 1414

[596] ət-Təbərsi, "İləmul-Vara bi Əaləmil-Hudə", 1/324-326;

hədislərini, hətta dar hədisini gizli nass olaraq müəyyən edir.[597] əl-Muhəqqiq ləqəbli Əbul-Qasim əl-Hilli deyir: "Gizli olana gəldikdə isə bu onun - aleyhissələm - "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır…" sözləridir…"[598] Bu cür misalları artıraraq göstərmək mümkündür ki, şiə alimləri arasında ümumən ğadir-xum hədisi gizli dəlillərdən sayılır. Bəli, doğrudur ki, bu hədisi aşkar dəlillərdən sayan şiə alimləri də az deyildir, lakin əgər şiə alimləri öz aralarında hədisin dəlalətinin aşkar və ya gizli olmasında ixtilaf ediblərsə bu özlüyündə bunun gizli olduğunu isbat edir. Ona görə də əs-Subhəni'nin iddia etdiyi "zəruri məna" batildir. Hətta əl-Murtəda əş-Şərif öz zamanında şiələrin ğadir hədisində "zəruri məna" iddia etdiklərini inkar edirdi. O deyir: "Peyğəmbərin - aleyhissələm - qəsdinin zəruri olaraq bilinməsinə gəldikdə isə bizim əshabımız ona bu xəbərdə və əmsalında etimad etmirlər."[599] Yəni ki, ğadir xum və onun kimi hədislərdəki sözlərdən peyğəmbərin - salləllahu aleyhi va səlləm - nəyi qəsd etdiyi zəruri olaraq bilinmir. Ona görə də Əbu Cəfər İbn Qibbə'dən sitat gətirərək deyir: "Çox sayda insanın hüzurunda deyilmiş nassa gəldikdə isə bu, Ğadir günü baş vermişdi və onların hamısı peyğəmbərin - aleyhissələm - sözünü xatırlayırdılar, amma onu fasid bir təvil ilə yozdular… çünki onların (ğadirdə deyilən sözlərdəki) muradın nə olduğunu bilməkləri labüd idi; zəruri olaraq bilməsələr də dəlil ilə bilməli idilər, çünki onlar ərəb dilini yaxşı bilirdilər…"[600] Bu sözləri İbn Qibbə'dən nəql edir, lakin başqa bir yerdə əl-Qadi Abdulcabbar'ın arqumentinə cavab verərkən deyir: "Səhabələrin nass barəsində batində nəyə etiqad etdiklərini bilməyimiz mümkün deyildir, onların halının ən uzağı dəlalət etdiyi budur ki, nassın xilafına etiqad edirdilər, bundan ötəsi bizə məlum deyildir."[601] Hətta etiraf edir ki, Əli bin Əbi Talib'in "yoldaşlarının əksəriyyəti və cumhuru onun seçilmə yolu ilə imam olduğuna etiqad edirdilər…"[602] Əgər Əlinin öz əshabının, yəni şiələrinin əksəriyyəti - əl-Murtəda'nın etirafına əsasən - onun ilahi təyinatlı imam olduğuna inanmırdısa necə iddia etmək olar ki, ğadir xum hədisi ilk nəsillərin nəzərində Əlinin vilayəti barəsində zəruri elm ifadə edirdi?!

---

[597] əl-Kəf'ami, "Məaricul-Əfhəm ilə İlm əl-Kələm", səh: 125;

[598] əl-Hilli, "əl-Məslək fi Usul əd-Din", səh: 309;

[599] "əş-Şəfi fil-İmamə", 2/282;

[600] Eyni mənbə, 2/128-129;

[601] Eyni mənbə, 2/138;

[602] Eyni mənbə, 2/156;

Bu deyilənin ən aşkar dəlillərindən biri budur ki, şiə kitablarındakı rəvayətlərdə şiələr imamlara bu hədisin mənaları haqqında sual verirlər. Misal üçün Əbu İshaq deyir: "Əli bin əl-Hüseynə dedim: "Peyğəmbərin "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" sözünün mənası nədir?"[603] əl-Himyəri'nin əd-Dələil kitabına nisbət edilən bir rəvayətdə əl-Həsən bin Tarif deyir: "Əbu Muhəmmədə yazaraq soruşdum ki, Allahın elçisinin möminlərin əmirinə "mən kimin mövlasıyamsa bu da onun mövlasıdır" deməsinin mənası nədir?"[604] Əbən bin Təğləb deyir: "Əbu Cəfər Muhəmməd bin Əlidən peyğəmbərin - "mən kimin mövlasıyamsa" sözü haqqında soruşdum…"[605] Əgər Ğadir hədisindəki sözlərin mənası bəzilərinin iddia etdikləri kimi aydındırsa şiə kitablarında yer alan bu rəvayətlərin hamısı mənasız olur, çünki mənası aydın olan bir şey haqqında sual verib soruşmazlar. əl-Murtəda əş-Şərif kitabında bu fikri bir daha təsdiq edərək deyir: "Bizə görə nəql olunmuş ləfzləri və onların dəlalətlərinin necəliyini nəzərə almağımız lazımdır və biz nə bunların isbatında, nə də qəsd olunan mənalarında zəruri elm olduğunu deməmişik."[606] Kitabının əvvəlində əl-Murtəda naslar haqqında danışarkən yazır: "Söz ilə deyilmiş naslara gəldikdə isə iki qismə ayrılır: Bunlardan biri; Allahın elçisinin - salləllahu aleyhi va əlihi - sözünü eşidənlərin onun muradını zəruri olaraq bildikləri sözlərdir ki, biz indi həmin sözlərlə qəsdin nə olduğunu istidlal ilə bilirik. Bu növ o naslardır ki, onların zahirində və ləfzinin aşkarında imamət və xilafət mənası yer alır. Bu növü bizim əshabımız cəli (aşkar) nass adlandırırlar. Bunun misalı peyğəmbərin - aleyhissələm - "Əliyə möminlərin əmirliyində beyət edin!" sözləridir və ya "Bu, məndən sonra sizin aranızda mənim xəlifəmdir, onu dinləyin və itaət edin!" İkinci qisim isə Allahın elçisinin - salləllahu aleyhi va əlihi - sözlərini eşidənlərin onun imamətə nass etdiyini zərurət olaraq bildiklərindən əmin olmadığımız növdür, bizə görə bu mənanı istidlal yolu ilə, yəni ləfzlərin dəlalətini nəzərə alaraq, onlardan nəyin qəsd edilməyə uyğun olub olmaması üzərində fikirləşmək yolu ilə (peyğəmbərin qəsdinin nə olduğunu) bilməkləri mümkündür. Bizim indiki zamanımıza gəldikdə isə biz o sözlərin isbatını və onlarda qəsd olunan mənanı yalnız istidlal ilə bilirik və bunun misalı peyğəmbərin - salləllahu aleyhi va əlihi - "Sənin mənə olan nisbətin Harunun Musaya olan nisbətidir, amma məndən sonra

[603] əs-Saduq, "Məani əl-Əxbər", səh: 65;
[604] əl-Məclisi, "Bihərul-Ənvar", 37/223;
[605] əs-Saduq, "Məanil-Əxbər", səh: 66;
[606] "əş-Şəfi fil-İmamə",, 2/192

bir peyğəmbər yoxdur" və ya "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" sözləridir. Bu növ nass bizim əshabımızın xəfi/gizli nass adlandırdığı növdür."[607] Bütün bu nəqllərdən sonra dəqiqliklə deyə bilərik ki, əl-Murtəda əş-Şərif ğadir-xum hədisini Cəfər əs-Subhəni'nin aid etdiyi kateqoriyaya aid etmir, çünki Cəfər əs-Subhəni iddia edir ki, Ğadir hadisəsində peyğəmbərin sözlərini eşidənlər onun nəyi qəsd etdiyini zəruri olaraq bilirdilər, əl-Murtəda əş-Şərif isə o cür düşünmür; o, əs-Subhəni'nin dediklərini birinci kateqoriyaya, yəni cəli olan, aşkar olan nassa aid edir, xəfi, yəni gizli olan nassı izah edərkən peyğəmbərin sözlərini eşidənlərin onu zəruri olaraq anlamadıqlarını deyir, ehtimal edir ki, ləfzlərin dəlalətlərinə nəzər salaraq, istidlal ilə muradını bilməkləri mümkün idi. O zaman daha əvvəl verdiyimiz suala bir daha qayıtmağımız lazımdır: Nə üçün peyğəmbərimiz - salləllahu aleyhi va səlləm - fikrini tam şəkildə ifadə etmək imkanı olduğu halda, insanların ən fəsahətlisi olduğu halda və heç kimdən qorxmadığı halda, Allah qatından ona ilahi təhdid gəldikdən sonra yenə də "aşkar sözlər" işlətmədi?! Bu sualın cavabını oxucuların insafına tərk edirik.

Lüğət və şəriət alimləri İslam tarixinin erkən dönəmindən bu mövzuları müzakirə etməyə başladıqda "mövla" sözünün ərəb dilində imam, dövlət başçısı, əmir kimi mənalarının olmadığını deyiblər. Şiələr isə bunun əksini isbat etmək üçün çox mürəkkəb tükətməli olublar. Şeyx Mufid'in bununla bağlı ayrıca iki risaləsi var. Bəhşəmi mötəzililərindən biri ilə bu məsələ üzərində mübahisə etdikdən sonra yazdığı bu risalələrindən birində həmin mötəzili aliminin mövla sözünün belə bir məna daşıdığını inkar etməsinə cavab verməyə çalışmışdır. əl-Mufid'in və digər şiə müəlliflərinin gətirdikləri dəlillərdən biri budur ki, "mövla" sözü ərəb dilində "əvla" sözü mənasında gəlir. Burda "əvla" sözü isə "ən layiq", "ən münasib" mənasını verir. Bunun üçün gətirilən dəlillərdən biri budur ki, Allah kitabında buyurur: "Sığınacağınız yer atəşdir və o, sizə mövladır." [57:15] əl-Mufid xatırladır[608] ki, ərəb dili alimi Əbu Ubeydə Muammər bin əl-Musənnə "Məcəzul-Quran" kitabında bu ayə haqqında buyurur: "O sizə mövladır", yəni ki, sizə ən layiqdir."[609] Beləliklə də əl-Mufid burada Quran ayəsini göstərərək və ərəb dili aliminin sözünü sitat gətirərək "mövla" sözünün mənalarından birinin "əvla" mənasını olduğunu isbat etməyə çalışır. Tələbəsi əş-Şərif əl-Murtəda da bu barədə geniş yazıb;

[607] Eyni mənbə, 2/67;

[608] əl-Mufid, "Risalə fi Mənə əl-Məvlə", səh: 37;

[609] Əbu Ubeyd, "Məcəzul-Quran", 2/254; Məktəbətul-Xanəci

"əş-Şəfi fil-İməmə" kitabında buna izah verdiyi kimi risalələrində də buna tez-tez toxunur. Risalələrinin birində öz arqumentini bu cür səsləndirir: "Ərəb dili alimləri arasında "əvla" sözünün mənası barəsində heç bir ixtilaf yoxdur. O, deyilən şeyə daha layiq və daha haqlı olan şəxsə işarə edir. Beləliklə, Peyğəmbər - salləllahu aleyhi və alih - "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" buyurduqda, "mövla" sözünü ehtiva etdiyi "əvla" mənasında işlətmişdir. Bu söz, hərçənd ki, digər mənaları daşıya bilər – məsələn, köməkçi, müttəfiq, azad etmiş (ağa), əmioğlu və s. – burada ehtimal daşıyan ləfz ilə - və bu, "mövla" ləfzidir - daha əvvəl aşkar şəkildə zikri keçmiş "daha layiq" (əvla) mənasının nəzərdə tutulmuş olması labüddür. Çünki ərəb dilində aydın ifadə olunmuş bir sözə əlavə edilən çoxmənalı söz, həmin açıq ifadənin mənasına uyğun başa düşülməlidir. Məgər görmürsən ki, bir şəxsin bir çox qulları olsa və o, bir qrup insana xitab edərək desə: "Siz mənim qulum Zeydi tanımırsınızmı?" Sonra əlavə etsə: "O zaman şahid olun ki, mənim qulum Allah yolunda azaddır", burada "qulum" sözünün birinci dəfə Zeyd üçün açıq şəkildə işlədildiyinə görə, ikinci dəfə deyiləndə də yalnız Zeyd nəzərdə tutulmalıdır. Əgər bununla başqa bir qul nəzərdə tutulsa, o, səfeh və qarmaqarışıq danışan biri sayılar."[610] əş-Şərif'in qəsd etdiyi budur ki, Peyğəmbər - aleyhi va alə əlihissalətu vassələm - "mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" sözünü demədən əvvəl xitabında "məgər mən möminlərə onların özlərindən daha yaxın (əvla) deyiləmmi?"[611] ritorik sualı ilə müraciət etmişdi. Burada gördüyümüz kimi "əvla" sözünü işlədib və bu, Qurandakı "Peyğəmbər möminlərə onların özündən daha yaxındır" [33:6] ayəsinə açıq-aşkar istinaddır. Beləliklə də əş-Şərif əl-Murtəda demək istəyir ki, Peyğəmbər - aleyhissələm - ilk cümləsində "əvla" sözünü işlətdiyi üçün ikinci cümlədəki "mövla" sözünü də "əvla" mənasına həml etmək lazımdır. Müasir şiə müəlliflərdən Muhsin Əli əl-Bəltistəni bu mövzuda xüsusilə "ən-Nəhcus-Səviy fi Mənəl-Məvla val-Valiy" adlı müstəqil bir kitab yazıb. Əli əl-Miləni isə "Hədisul-Ğadir" kitabında bu mövzuya xüsusi bir yer ayırıb. Bunların hamısında "mövla" sözü ilə Peyğəmbərin həqiqi muradının nə olduğu isbat olunmağa çalışılır.

Əhlüs-sünnət alimlərinin ciddi bir hissəsi şiələrin bu iddialarına qarşı etiraz edərək hər şeydən əvvəl "mövla" sözünün ərəb dilində "əvla" mənasında gəlmədiyini deyiblər. Böyük mütəkəllim əl-Bəqilləni misal üçün deyir: "Mövla sözü ərəb dilində bir çox məna daşıyır, onların

---

[610] "Rasəil əl-Murtəda", 4/131-132;

[611] "Musnəd Əhməd", 38/32; İsnadı səhihdir.

arasında "əvla" mənası yoxdur."[612] Lakin məlumdur ki, əhlüs-sünnətin təfsir kitablarında "sığınacağınız yer atəşdir və o, sizə mövladır" [57:15] ayəsinin təfsirində "ona daha layiqdir", yəni ərəbcə "ona daha əvla'dır" şəklində təfsir mövcuddur, hətta demək olar ki, əksər təfsir kitabları bu izaha üstünlük verirlər. Buna izah gətirmək istəyən alimlərimiz deyiblər ki, bu sadəcə olaraq ayəni məna baxımından təfsir etməkdir, yoxsa burada "mövla" sözünə lüğəvi bir izahat vermək qəsdi yoxdur. Ona görə də Tacul-Qurra Əbul-Qasim əl-Kirməni yazır: "Təfsir kitablarında müfəssirlərin "ora sizin üçün daha əvladır" deməklərinə gəldikdə isə bu, məna cəhətdəndir, yoxsa ləfzi/etimoloji izah deyildir, çünki "məf'əl" vəzni üstünlük dərəcəsi mənasında işlənmir."[613] Fəxruddin ər-Razi yazır: "Onların dedikləri bu söz məna cəhətdən izahdır, yoxsa ləfzin özünün tərcüməsi deyildir, çünki "mövla" və "əvla" dildə eyni mənada olsaydı o zaman birini digərinin yerində işlətmək doğru olardı və "bu, fılankəsdən daha əvladır" deyildiyi kimi "bu, fılankəsdən daha mövladır" deməyin də doğru olması gərəkərdi… Bu isə batil olduğu üçün anlayırıq ki, onların dedikləri sadəcə məna cəhətdən izahdır, sözün tərcüməsi deyildir."[614] Şihəbuddin əl-Alusi də təfsirində ər-Razi'nin arqumentinin eynisini gətirərək bu rəyə etiraz edir.[615] İbn Həyyan əl-Əndəlusi deyir ki, "bu, yalnız mənanın tərcüməsidir."[616] İbn Atiyyə də təfsirində yazır ki, "təfsir alimləri (bu ayənin) mənasının "o sizə əvladır" olduğunu dedilər. Bu isə məna ilə təfsirdir. Əslində isə (ləfz olaraq) bu istiarədir (yəni məcazdır), onları içinə aldığı üçün, onlara toxunduğu üçün onları himayə etmiş olur, onlar üçün mövla yerinə keçir."[617] Həmçinin Seyfuddin əl-Əmidi deyir ki, "əl-Mövlə sözünü "əvla" mənasında yozmaq mümkün deyildir, çünki bu, ərəb dilində əslən bu mənada gəlməyib. Allahın "sığınacağınız yer atəşdir və o, sizə mövladır" sözündəki məna "sizə əvladır" mənası deyildir, sizin son mənziliniz və yerinizdir deməkdir."[618] Lüğət və qiraət alimlərindən Muntəcəbuddin əl-Həməzəni hər iki təfsiri qeyd etdikdən sonra deyir ki, "birinci təfsir üstün görülüb, çünki mövla sözü (ərəb dilində) "əvla" mənasında nadirdir, az qala mövcud

---

[612] əl-Bəqilləni, "Təmhidul-Əvail va Təlxisud-Dələil", səh: 451; Muəssəsə əl-Kutub əs-Səqafiyyə, 1407

[613] əl-Kirməni, "Ğaraibut-Təfsir va Acaib ət-Təvil", 2/1186; Darul-Qiblə, Ciddə

[614] ər-Razi, "Məfətihul-Ğeyb", 29/459;

[615] əl-Alusi, "Ruhul-Məani", 3/361;

[616] İbn Həyyən, "əl-Bəhr əl-Muhit", 10/107;

[617] "Təfsir İbn Atiyyə", 5/264;

[618] əl-Əmidi, "Ğayətul-Məram", səh: 378;

deyildir."[619] Həmçinin Şəmsuddin əl-Əsfəhəni də şiə alimi Nəsiruddin ət-Tusi'nin "Təcridul-Aqaid" kitabına yazdığı şərhində yuxarıdakı arqumentləri eyni şəkildə səsləndirir.[620] Həm əl-Kirməni'nin, həm də ər-Razi'nin sözlərində güclü arqumentlər var; "məf'əl" vəzni üstünlük mənasında gəlməyib, əgər belə olsaydı bu sözlərin bir-birini əvəz etməsi icazəli olardı ki, ərəb dilində bunun misallarına rast gəlmirik.

Lakin məsələ bu qədər bəsit deyildir. əl-Mufid'in və digər şiələrin Əbu Ubeydə'dən gətirdikləri misalda "mövla" sözünün məna cəhətdən yoxsa lüğət cəhətdən izah olunması sorğulana bilər. Amma insaf xatirinə etiraf etməliyik ki, bunu təkcə Əbu Ubeydə demir. Əlavə edə bilərik ki, Əbu Ubeydə'nin müasirlərindən olan bir başqa dil alimi Əbu Zəkəriyya əl-Fərra da eyni izaha yer verir.[621] Onların məşrəbindən içmiş İbn Quteybə əd-Dinəvari, Əbu Bişr əl-Bəndənici, Əbul-Abbas əl-Mubərrad, İbn Cərir ət-Tabəri, Əbu İshaq əz-Zəccəc, Əbu Bəkr əl-Ənbəri, İbn Abbad, Əbu Ubeyd əl-Həravi, Məkki bin Əbi Talib, İbn Fətuh əl-Məyurqi, İbn Muslim əs-Suhari və başqa dil alimləri də bu məsələdə Əbu Ubeydə'nin izahına tabe olublar.[622] Onların sözlərini oxuduqda zahirən görünən budur ki, onlar sadəcə məna təfsiri vermirlər, dil baxımından izah verirlər. Bu alimlər isə ərəb dili alimləridir və əgər ərəb dili mövzusunda ər-Razi, əl-Kirmani, əl-Baqilləni, əl-Əmidi kimi hədis və kəlam alimlərinin sözləri ilə dilçi alimlərin sözləri arasında seçim etməli olsaq dilçi alimlərin sözünü götürmək daha məntiqli olacaq. Bu o demək deyildir ki, dilçi alimlər arasında bu fikir ittifaq məsələsidir, lakin "mövla" sözünün "əvla" mənasında gəldiyini deyən dil alimləri çoxluq təşkil edir. Ancaq altının xəttini cızaraq qeyd etmək lazımdır ki, əl-Həməzəni'nin dediyi kimi ərəb dilində "mövla" sözünün bu mənada gəlməsi çox nadirdir, hətta əl-Hədid surəsindəki ayədə "mövla" sözünün "əvla" mənasında gəlməsi mübahisəli olaraq qalır.

---

[619] əl-Həməzəni, "əl-Kitəb əl-Fərid fi İrab əl-Quran əl-Məcid", 6/100;

[620] əl-Əsfəhəni, "Təsdidul-Qavaid fi Şərh Təcrid əl-Aqaid", 3/472; Türkiyə Diyanət Vəqfi

[621] əl-Fərra, "Məanil-Quran", 3/134;

[622] Bax: İbn Qureybə, "Ğaribul-Quran", səh: 453; Əbu Bişr, "ət-Təfqih fil-Luğa", səh: 115; əl-Mubərrad, "əl-Kəmil fil-Luğati val-Ədəb", 4/39; "Təfsir ət-Tabəri", 23/187; əz-Zəccəc, "Məanil-Quran va İrabuhu", 5/125; əl-Ənbəri, "əz-Zəhir fi Məani Kəlimət ən-Nəs", 1/125 və "Kitəb əl-Əzdad", səh: 46; İbn Abbad, "əl-Muhit fil-Luğa", 10/380; əl-Həravi, "əl-Ğaribeyn", 6/2034; Məkki, "əl-Hidəyə ilə Buluğ ən-Nihəyə", 11/7360; əl-Məyurqi, "Təfsiru Ğarib mə fis-Sahiheyn", səh: 322; əs-Suhari, "əl-İbənə fil-Luğatil-Arabiyyə", 4/306;

Mövla sözünün "əvla" mənasında gəldiyini isbat etmək şiələrin iddiasını isbat etmək üçün kifayət etmir, çünki "əvla" sözü "daha layiq" və ya "daha münasib", ya da "ən layiq" və "ən münasib" mənalarını ifadə edir. Lakin bu söz özlüyündə tam bir məna ifadə etmir, çünki ortaya belə bir sual çıxır: nədə və hansı məsələdə daha layiq və daha münasibdir? Şiə alimləri mənanı tamamlamaq üçün belə təklif edirlər ki, burada çatışmayan söz "təsərrüf" sözüdür, yəni "əvla bit-təsarruf", təsərrüf etməkdə daha əvladır. Burada sünnət əhli təbii ki, etiraz edirlər və deyirlər ki, "təsarruf" və ya "itaət" sözləri yerinə burada "məhəbbət" və ya "təzim və hörmət" sözlərini də qoymaq mümkündür. Bu baxımdan Allahın elçisi "məgər mən möminlərə özlərindən daha əvla deyiləmmi" soruşduqda bununla "məgər mən sevilməkdə möminlərə özlərindən daha layiq deyiləmmi" və ya "məgər mən təzim olunmaqda möminlərə özlərindən daha layiq deyiləmmi" mənasını da qəsd etmiş olması mümkündür. O zaman "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" dediyində, "mən kimin üçün sevilməyə daha layiqəmsə, Əli də onun üçün sevilməyə daha layiqdir" mənasını qəsd etmişdir. Təfsir alimi əl-Alusi deyir: "Hətta əgər 'mövla' sözünün 'əvla' (daha layiq, daha münasib) mənasında olduğunu qəbul etsək belə, ona qoşulacaq sözün "təsərrüf" (hökm və idarəetmə haqqına sahiblik) olması şərt deyildir. Əksinə, (təsərrüfdə daha layiq yerinə) burada 'məhəbbətdə daha layiq', 'hörmət və təzim baxımından daha layiq olmaq' kimi mənaları da daşıya bilər. Çünki 'əvla' sözü o qədər yerdə işlənmişdir ki, orada hökm və idarəetmə mənasını vermək düzgün olmaz, misal üçün Allah deyir: "Həqiqətən, insanlardan İbrahimə ən yaxın (əvla) olanı, onun ardınca gedənlər, bu Peyğəmbər və iman gətirənlərdir."[623] Aydındır ki, İbrahimə nisbətdə ən yaxın olmaq burada onun yolunu getməkdə, ona tabe olmaqda ona ən çox yaraşan, ona ən çox layiq olan mənası qəsd olunur. Hədid surəsindəki ayədə "Peyğəmbərin möminlərin özlərindən onlara daha yaxın olması" mənasına dəldikdə isə bu barədə eyni ehtimallar mövcuddur. Əbu Mənsur əl-Məturidi deyir: "Sonra burada möhtəməldir ki, onların özlərindən – itaət, hörmət və təzim baxımından - daha layiqlidir. Yəni, O, başqalarından daha çox təzim olunmağa, hörmətə və itaət olunmağa layiqdir. Və ya bu mənada da ola bilər ki, O, onlara qarşı mərhəmət və şəfqət baxımından daha layiqlidir, yəni O, onlara özlərindən daha rəhmli və şəfqətlidir. Çünki Allah onu mərhəmət və lütfkarlıqla vəsf edərək demişdir: "O sizə qarşı qayğıkeşdir, möminlərə qarşı çox şəfqətli və mərhəmətlidir." [9:128]

---

[623] əl-Alusi, "Ruhul-Məani", 3/361;

… Və ya "O, onlara daha layiqdir" ifadəsi belə başa düşülə bilər: yəni O, onların özlərindən və övladlarından daha çox sevilməyə layiqdir – seçim və fədakarlıq sevgisi ilə. Lakin bu, təbii meyl və qəlbin cəzb edilməsi mənasında deyil, çünki qəlbin cəzb olunması təbiətə bağlıdır."[624] Biz hədis ədəbiyyatına baxdıqda Peyğəmbərin - aleyhissələm - özünün bu sözləri necə başa düşdüyünü görürük. Sufyan əs-Səvri bizə İmam Cəfər əs-Sadiq'dən, o da Muhəmməd əl-Baqir'dən, o isə səhabə Cabir bin Abdilləh'dən rəvayət edir ki, Allahın elçisi - salləllahu aleyhi va sələm - deyərdi: "Mən möminlərə onların özlərindən daha yaxınam; hər kim (ölüm) geridə mal buraxarsa onun ailəsinə aiddir, amma əgər borcu buraxarsa və ya malı zay olarsa mənim boynumdadır, çünki mən möminlərə daha yaxınam."[625] Həmçinin Əbu Hureyra rəvayət edir ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - buyurdu: "Elə bir mömin yoxdur ki, mən ona dünya və Axirətdə özündən daha yaxın olmayım. İstəsəniz bu ayəni oxuyun: "Peyğəmbər möminlərə onların özündən daha yaxındır." Hansı mömin ölər və özündən sonra mal buraxarsa, qohumları onu miras alar. Amma hər kim borc buraxarsa və ya tələf olmuş bir şey buraxarsa qoy mənim yanıma gəlsin, mən onun mövlasıyam."[626] Əbul-Muzaffər əs-Səmani təfsir kitabında bu hədisi birinci məna üçün dəlil gətirdikdən sonra deyir: "Bu ayə barəsində ikinci bir rəy də vardır və o, budur ki, Allahın elçisi əgər bir kimsəni bir şeyə çağırarsa, adamın nəfsi isə onu başqa şeyə çağırarsa, Allahın elçisinə tabe olmalı, öz nəfsinə tabe olmamalıdır. Üçüncü rəy də budur ki, Peyğəmbər cihada çıxardı və bir qrup insan deyərdi: "Ey Allahın elçisi, gedib atalarımız və analarımızdan izn alaqmı?" Bunun üzərində Allah - təalə - bu ayəni nazil etdi."[627] Başa düşürük ki, sözü gedən ayədəki "əvla" sözündəki məna daha genişdir; şəfqət, mərhəmət, təzim, məhəbbət, hörmət və itaət baxımından daha layiq olmağı ifadə edir. Ona görə də əş-Şərif əl-Murtəda'nın hədisdəki "mövla" sözünü "əvla" olaraq isbat etməsi yenə də şiələrin bu hədis haqqında iddialarını dəstəkləməz. Əksinə hədisin tamamına baxdıqda həm məzmun baxımından, həm də ləfz baxımından əhlüs-sünnətin verdiyi izah öz təsdiqini tapmış olur; çünki məzmun bunu göstərir ki, Allahın elçisi - salləllahu aleyhi va əlihi va

---

[624] əl-Məturidi, "Təvilət Əhlis-Sunnə", 8/353;

[625] "Sahih Muslim", 867; "Musnəd Əhməd", 22/467; Abdurrazzaq, "əl-Musannəf", 8/291 (15262);

[626] "Sahih əl-Buxari", 2/845;

[627] "Təfsirus-Səmani", 4/259;

sələm - Əli haqqında şikayətlər eşitdiyi üçün, bəziləri açıq şəkildə Əliyə nifrət etdiklərini dediyi üçün bu sözlərini demişdir. Ləfz baxımından da bu izah ən doğru mənadır, çünki Peyğəmbər - aleyhissalətu vassələm - "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" dedikdən sonra belə dua edir: "Allahım, onu sevəni (valə) sev, ona düşmənçilik edənə düşmən ol!"[628] Peyğəmbər bu duasında sevmək sözü üçün "mövla" ləfzi ilə eyniköklü olan "valə" (والى) felini işlədir.

Yekun olaraq deyə bilərik ki, əhlüs-sünnətin nəzərində dəlillər buradakı mövla sözünün sevilən, qayğı göstərilən mənasında olduğunu göstərir. Şiə alimlər hər nə qədər müxəlif metodlar və təvillər ilə mövla sözünə "əmir", "imam" mənaları vermək istəsələr də ərəb dilində mövla sözünün belə bir mənası yoxdur. Ona görə də İbn Həcər əl-Heytəmi haqlı olaraq yazır: "Mövla sözünun nə ərəb dilində, nə də şəriətdə imam mənasında işləndiyi bilinmir."[629] Ğadirxum hədisindəki məna ona görə də Kufənin məşhur ərəb dili alimlərindən Əbul-Abbas Sə'ləb'in (h. 200-291) dediyi kimidir: "Mənası budur ki, "kim məni sevərsə, dost edinərsə qoy onu da sevsin!"[630]

## Saqaleyn hədisi

Heç bir kitab bu mövzu ilə bağlı müzakirədə saqaleyn hədisinə toxunmadan keçə bilmir. Bu mövzuda qarşıya qoyulan dəlillərdən biri kimi "saqaleyn hədisi" də əhlüs-sünnət kitablarında səhih kanallarla sabit olmuş bir hədisdir. Qısa olaraq "sizə iki ağır əmanət tərk edirəm; Allahın Kitabı və itrətim Əhlu Beytim" şəklində səslənən hədisə əsaslanan şiə alimləri deyirlər ki, əhlul-beytin Kitab ilə yanaşı qeyd edilməsi onlara da itaət etməyin vacibliyini tələb edir. Şeyx əs-Saduq deyir: "Biz etiqad etməliyik ki, Kitab heç vaxt onunla birlikdə olan, Rəsulullahın - salləllahu aleyhi və alih - itrətindən təvili və tənzili bilən biri olmadan qalmaz. Çünki hədis bunu vacib

[628] "Musnəd Əhməd", 32/56; Şeyx Şueyb isnadının səhih olduğunu yazır.

[629] əl-Heytəmi, "əs-Savaiq əl-Muhriqa", 1/108;

[630] əl-Əzhəri, "Təhzibul-Luğa", 15/322;

edir."[631] əş-Şərif əl-Murtəda isə əl-Qadi Abdulcabbar'a cavabında səqaleyn hədisi haqqında deyir: "Bu söz - sənin özünün də təsdiqlədiyinə görə - Əhli-Beytin icmasının hüccət olduğuna dəlalət edir. Bu mərtəbənin isbatından sonra həmçinin möminlərin əmirinin - aleyhissələm - Peyğəmbərdən - salləllahu aleyhi və alih - nass ilə dərhal sonra imam olmasına və əhlul-beytin - aleyhimussələm - icma etdikləri bundan başqa məsələlərə də dəlalət edir. Bunu həmçinin hər bir dövrdə əhlul-beytin arasında sözünün doğruğunda qəti əminlik olan məsum və etibarlı bir imamın olmasına dair dəlil və hüccət gətirmək də mümkündür."[632] əş-Şərif əl-Murtəda bu hədisin imamətə dəlalətini iki addım ilə isbat etməyə çalışır. Birinci addım budur ki, bu hədis əhlul-beyin icmasının hüccət olduğunu göstərir. Belə çıxır ki, ikinci addım burada əhlul-beytin Əlinin imamlığı üzərində icma etməsi olmalıdır. O deyir: "Əgər əhlul-beytin icmasının hüccət olduğu sabit olarsa, onların üzərində ittifaq etdikləri hər bir şeyin doğru olduğuna qəti şəkildə hökm verərik. Onların üzərində ittifaq etdikləri məsələlərdən biri də möminlərin əmirinin - aleyhissələm - Peyğəmbərdən - salləllahu aleyhi və alih - dərhal sonra imam olmasıdır. Onların bu məsələdə fərqli yanaşmaları yalnız bunun açıq bir nassla, yaxud gizli bir nassla, təvilə ehtimalı olan və ya olmayan bir dəlillə sabit olması barəsində olmuşdur."[633]

Biz şiə alimlərin arqumentlərinə nəzər salmadan əvvəl səqaleyn hədisinin fərqli rəvayət yollarına və fərqli ləfzlərinə nəzər salacağıq. Çünki hədis eyni hədis olsa da ravilər bunu fərqli sifətlərdə və formalarda rəvayət ediblər. Biz bunların içində ən səhih olanı və onun mətnini ortaya qoyacağıq ki, əsl səqaleyn hədisinin özündə daşıdığı məna oxuculara aşkar olsun.

Əbu Said əl-Xudri rəvayət edir ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - dedi: "Həqiqətən, tezliklə çağırılacam və mən ona cavab verməli olacam. Mən sizin aranızda iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabını və itrətim. Allahın Kitabı göydən yerə uzadılmış bir ipdir. İtrətim əhli-beytimdir. Həqiqətən, Latif və Xabir olan Allah mənə xəbər verdi ki, onlar qiyamət günü hovuzun kənarında mənim yanıma gələnə qədər bir-birindən ayrılmayacaqlar. Buna görə də, mənim

---

[631] əs-Saduq, "Kəməlud-Din", 1/92

[632] əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İməmə", 3/122; Muhəmməd Hüsen əd-Dirayəti'nin təhqiqində isə 4/461-ci səhifəyə bax.

[633] Eyni mənbə, 3/126; əd-Dirayəti təhqiqində 4/467;

yerimə onlara necə münasibət bəsləyəcəyinizə diqqət edin."[634] Bu rəvayəti əl-Aməş kufəli şiə ravi Atiyyə əl-Avfi'dən, o da Əbu Said əl-Xudri'dən rəvayət edir. Abdulməlik bin Əbi Süleyman, İsmail bin Əbi İshaq əl-Muləi, Əbu İsrail'in Atiyyə'dən, onun da Əbu Said əl-Xudri'dən rəvayət etdiyi ləfz isə belədir: "Həqiqətən, mən sizin aranızda iki dəyərli şey qoyub gedirəm. Əgər onlara sarılsanız, məndən sonra heç vaxt azmazsınız: biri digərindən böyük olan iki ağır əmanət – Allahın Kitabı, göylə yer arasında uzanan bir ip, və itrətim, Əhli-Beytim. Agah olun ki, onlar qiyamət günü hovuzun kənarında mənim yanıma gələnə qədər bir-birindən ayrılmayacaqlar."[635] Atiyyə bin Said əl-Avfi isə kufəli şiə zəif ravidir.

Huzeyfə bin Əsid rəvayət edir ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - dedi: "Ey insanlar! Həqiqətən, mən sizdən əvvəl gedənəm və siz mənim yanıma hovuzun kənarına gələcəksiniz. Mənim hovuzumun eni Sən'a ilə Busra arasındakı məsafə qədərdir. Onun içində ulduzların sayı qədər qızıl və gümüş qablar var. Mən sizə gələndə iki əmanət (səqəleyn) haqqında soruşacağam. Baxın görün, məndən sonra onlara necə yanaşacaqsınız. Böyük səbəb Allahın Kitabıdır: onun bir tərəfi Allahın əlində, digər tərəfi sizin əlinizdədir. Onu möhkəm tutun ki, azmayasınız və dəyişməyəsiniz. Digəri isə itrətim, Əhli-Beytimdir. Çünki Alim və Xəbərdar olan (Allah) mənə xəbər verdi ki, onlar hovuzumun kənarında mənə qovuşana qədər bir-birindən ayrılmayacaqlar."[636] İsnadı zəifdir, çünki isnadındakı Zeyd bin əl-Həsən əl-Ənməti haqqında Əbu Hətim deyib: "Hədisi münkərdir." O bunu Məruf bin Xarrabuz'dan rəvayət edir ki, onu İbn Main zəif saymış və İmam Əhməd haqqında demişdir: "Hədisinin necə olduğunu bilmirəm." əl-Uqeyli onu zəif ravilər arasında qeyd edir və deyir: "Hədislərinə heç kim tabe olmur, hədisləri yalnız özü vasitəsi ilə bilinir."[637] Bir başqa hədisdə Cabir bin Abdilləh deyir: "Mən Peyğəmbəri - salləllahu aleyhi və səlləm - Həccində Ərəfə günü onun Qasva adlı dəvəsi üstündə xütbə oxuyarkən gördüm. Onun belə dediyini eşitdim: 'Ey insanlar! Həqiqətən, mən sizin aranızda

[634] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 2/194 (Dar Sadir); İbn əl-Cad, "əl-Musnəd", səh: 397 (2711); Əhməd, "Fədail əs-Sahabə", (1383); Əhməd, "əl-Musnəd", 17/211-212 (11131)

[635] Əhməd, "Fədail əs-Sahabə", (990, 1382); Əhməd, "əl-Musnəd", 17/169-170, 308-309, 18/114 (11104, 11211, 11561); "Sünən ət-Tirmizi", (4122); İbn Əbi Asim, "əs-Sunnə", (1553, 1554)

[636] Bəqiy bin Məxləd, "əl-Həvd val-Kəvsər", (16); ət-Tabərani, "əl-Mucəm əl-Kəbir" (2683, 3052);

[637] Şeyx Şueybin "Musnəd Əhməd" kitabında (17/173-174) əlavə etdiyi qeydə bax.

sarıldığınız təqdirdə əsla azmayacağınız bir şey buraxıram: Allahın Kitabı və itrətim, Əhli-Beytim.” ət-Təbərani bu hədisi rəvayət etdikdən sonra deyir: “Cəfər bin Muhəmməd’dən bu hədisi Zeyd bin əl-Həsən əl-Ənməti’dən başqa heç kim rəvayət etmir.”[638] Zeyd qeyd etdiyimiz kimi hədisləri münkər sayılmış bir ravidir.

Bu hədisin daha bir maraqlı ləfzi vardır. Zeyd bin Səbit’dən rəvayət edilir ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - deyib: “Həqiqətən, mən sizin aranızda iki xəlifə qoyub gedirəm: Allahın Kitabını və itrətimi (Əhli-Beytimi). Həqiqətən, onlar qiyamət günü hovuzun kənarında mənim yanıma gələnə qədər bir-birindən ayrılmayacaqlar.”[639] Ləfzin maraqlı tərəfi isə budur ki, “səqaleyn” sözü yerinə burada “xəlifəteyn”, yəni iki xəlifə sözü işlədilmişdir. Məlumdur ki, bu hədis məşhur “səqaleyn” hədisidir, lakin bunu rəvayət edən kufəli şiə ravi Şərik bin Abdilləh ən-Nəxai digər ravilərə müxalif olaraq “xəlifəteyn” sözləri ilə rəvayət edib. Şərik bin Abdilləh isə rəvayətlərdə bu cür xətalar etməklə tanınıb. Alləmə Abdurrahmən bin Yəhya əl-Muallimi əl-Yəməni onun haqqında deyir: “Rəvayətə gəldikdə o, çoxlu xətalar edən və qatıb-qarışdıran biridir, ona görə də təkbaşına rəvayət etdiklərində və ya başqalarına müxalif olduqlarında hüccət deyildir. əd-Dəraqutni, İbnul-Qattən və Abdulhaqq ona tədlis də nisbət ediblər.”[640]

əl-Bəzzar “əl-Musnəd” kitabında Əli bin Əbi Talib’in belə dediyini rəvayət edir: “Allahın elçisi - salləllahu aleyhi va səlləm - dedi: “Həqiqətən, mən (bu dünyadan) götürüləcəyəm və mən sizin aranızda iki ağır əmanət qoyub gedirəm: Allahın Kitabı və Əhli-Beytim. Siz onlardan sonra heç vaxt azğınlığa düşməyəcəksiniz. İtmiş dəvə axtarıldığı kimi Allah Rəsulunun - salləllahu aleyhi və səlləm - səhabələri axtarılacağı vaxt gəlməyənə qədər Qiyamət qopmayacaq, lakin (axtılsa da) tapılmayacaqlar.”[641] Bu rəvayətin ləfzindəki maraqlı tərəf budur ki,

---

[638] ət-Təbərani, “əl-Mucəm əl-Kəbir”, 5/89 (4757); “Sunən ət-Tirmizi”, (4120); Şeyx Şueyb deyir ki, isnadındakı Zeyd bin Həsən əl-Quraşi zəif ravidir.

[639] İbn Əbi Şeybə, “əl-Musannəf”, 6/309 (31679) əl-Hut çapı; Əhməd, “Fədail əs-Sahabə”, (1403); Əhməd, “əl-Musnəd”, 35/456 (21578); İbn Əbi Asim, “əs-Sunnə”, (754, 1548, 1549) Şeyx Şueyb səqaleyn hədisinin özünün səhih olduğunu desə də bu hədisin bu isnad ilə zəif olduğunu deyir. O “əl-Musnəd” kitabına atdığı qeydində buyurur: “Bu hədis - 'onlar hovuzun kənarında mənə qovuşana qədər ayrılmayacaqlar' hissəsi istisna olmaqla - şahidləri ilə birlikdə səhihdir. Bu isnad isə Şərikin yaddaşının zəifliyinə görə zəifdir və o, İbn Abdilləh ən-Nəxai’dir.”

[640] əl-Muallimi, “ət-Tənkil bimə fi Tənib əl-Kəvsəri minəl-Əbatil”, 1/484; əl-Məktəb əl-İsləmi

[641] “Musnəd əl-Bəzzar”, 3/89 (864);

əhlul-beyt ilə yanaşı səhabələrin yolu üzərinə vurğu edilir. İsnadı isə zəifdir.[642] Yenə əl-Bəzzar "əl-Musnəd" kitabında Əbu Hureyra'dan belə dediyini rəvayət edir: "Allahın elçisi - salləllahu aleyhi va sələm - dedi: "Mən sizin aranızda iki şey buraxıram ki, onlardan sonra heç zaman azmayacaqsız. Allahın kitabı və nəsəbim. Bu ikisi hovuza gələnə qədər ayrılmayacaqlar."[643] Nuruddin əl-Heysəmi deyir ki, "bunu əl-Bəzzar rəvayət edib, orada Saleh bin Musa ət-Tilhi var və o zəifdir."[644] əl-Həkim ən-Nisəburi bu hədisin eynisini rəvayət edir, lakin "nəsəbim" yerinə "sünnətim" sözünü zikr edir.[645]

Bu rəvayətlərin içində isnad baxımından digərlərindən daha güclü olanlara nəzər salaq. ən-Nəsai, ət-Tahavi və əl-Hakim'in rəvayət etdiklərinə əsasən Zeyd bin Ərqam demişdir: "Peyğəmbər - salləllahu aleyhi və səlləm - Vəda həccindən qayıtdıqdan və Qədir-Xumda dayandıqdan sonra, bəzi ağacların kölgəsi altını təmizləməyi əmr etdi. Sonra buyurdu: "Sanki mən çağırılmaqdayam və cavab verəcəm (yəni ölümüm yaxınlaşır). Mən sizə iki ağır əmanət qoyub gedirəm: onların biri digərindən daha böyükdür – Allahın Kitabı və itrətim, Əhli-Beytim. Baxın görün, mənim yerimə onları necə qoruyacaqsınız? Çünki onlar hovuzun kənarında mənə qovuşana qədər bir-birindən ayrılmayacaqlar." Sonra buyurdu: "Şübhəsiz ki, Allah mənim mövlamdır və mən hər bir mömininin dostuyam." Daha sonra Əlinin əlini tutaraq dedi: "Mən kimə mövlayamsa, bu Əli də onun mövlasıdır. Allahım! Onu dost tutanı dost tut, ona düşmən olana düşmən ol!" Mən Zeydə dedim: "Bunu Peyğəmbərdən - salləllahu aleyhi və səlləm - öz qulaqlarınla eşitmisənmi?" O dedi: "Ağac kölgəsində olan heç kim yox idi ki, bunu öz gözləri ilə görməsin və öz qulaqları ilə eşitməsin."[646] Bu hədisi ət-Tahavi və əl-Hakim səhih sayırlar, çünki isnadındakı ravilər

---

[642] Şeyx Şueyb "əl-Musnəd" kitabının təhqiqində (17/172-173) deyir ki, isnadı zəifdir; əl-Hüseyn bin Əli bin Cəfər haqqında Əbu Hatim deyib: "Onu tanımıram." ən-Nəsai deyib: "Salehdir." Suad bin Süleymana gəldikdə isə onu Əbu Hətim zəif sayıb və Əbu İshaq əs-Səbi'idən yaddaşı pozulduqdan əvvəl hədis eşitmişlər arasında adı zikr olunmur. Bunu Əlidən rəvayət edən ravi əl-Haris bin Abdilləh əl-Avar isə zəif ravidir. Üstəlik Şubə deyib: "Əbu İshaq əl-Haris'dən dörd hədisdən başqasını eşitməyib." Ona görə də Yəhya bin Said rəvayət edərkən əl-Haris'in hədisləri arasından yalnız Əbu İshaqın "mən əl-Harisi eşitdim" deyərək rəvayət etdiklərini rəvayət edərdi. Bu rəvayətdə isə Əbu İshaq bu hədisi əl-Haris'dən eşitdiyini demir.

[643] "Musnəd əl-Bəzzar", 2/332-333 (1963)

[644] əl-Heysəmi, "Məcməuz-Zəvaid", 9/163 (14958)

[645] əl-Hakim, "əl-Mustədrak aləs-Sahiheyn", 1/439 (323) ər-Risələ çapı.

[646] ən-Nəsai, "əs-Sunən əl-Kubra", 7/310 və 437 (8092, 8410); ət-Tahavi, "Şərh Muşkil əl-Əsər", 1765;

siqadır. Lakin bu isnadda gizli olan problem budur ki, bunu rəvayət edən Həbib bin Əbi Səbit siqa ravi olsa da bunu Əbu Tufeyl'dən eşitməyib. İbn əl-Mədini demişdir: “İbn Abbasla qarşılaşmış, Aişəni dinləmişdir. Səhabədən bu ikisindən başqa heç kimdən eşitməyib.” əl-Buxari də “ət-Tarix əl-Kəbir”də yalnız İbn Abbas və İbn Ömər'dən eşitdiyini deyir.[647] Bu hədisi isə Əbut-Tufeyl'dən rəvayət edir. İbn Əbi Asim və ət-Tahavi'nin rəvayətində isə Muhəmməd bin Ömər bin Əli vasitəsi ilə atası Ömər bin Əli'dən, o da atası Əli bin Əbi Talib'dən rəvayət edirlər ki, Allahın elçisi - salləllahu aleyhi va səlləm - demişdir: “Sizin aranızda elə bir şey tərk edirəm ki, ona tutunduğunuz təqdirdə azmayacaqsınız: Allahın kitabı, onun ipinin bir tərəfi Allahın əlində, o biri tərəfii sizin əlinizdədir və əhli beytimi.”[648] əl-Busiri və İbn Həcər isnadının səhih olduğunu deyiblər.[649] Əhlüs-sünnətə görə bu iki rəvayətdə qəsd olunan əmanətə qarşı qayğıdır; Peyğəmbər - aleyhissalətu vassələm - ümmətini bu iki əmanətə qarşı məsuliyyətli və qayğıkeş olmağa təşviq edir. Bu məna səqaleyn hədisinin ən səhih variantı ilə öz təsdiqini tapır. Beləki İmam Muslim'in “əs-Sahih” kitabında rəvayət etdiyinə görə Yezid bin Həyyan deyir: “Mən, Husayn bin Səbrə və Ömər bin Müslim birlikdə Zeyd bin Ərqəmin yanına yola düşdük. Onun yanında oturduqdan sonra Husayn ona belə dedi: "Ey Zeyd! Sən çox böyük xeyir görmüsən. Sən Allah Rəsulunu - salləllahu aleyhi və səlləm - görmüsən, onun hədislərini eşitmisən, onunla birlikdə döyüşlərə qatılmısan və onun arxasında namaz qılmısan. Həqiqətən, sən çox böyük xeyir görmüsən. Ey Zeyd, bizə Allah Rəsulundan eşitdiyin bir şeyi danış." Zeyd bin Ərqəm dedi: "Ey qardaşım oğlu, Allaha and olsun ki, yaşım artıq çoxalıb, dövrüm keçib və mən Allah Rəsulundan - salləllahu aleyhi və səlləm - yadda saxladığım şeylərin bir qismini unutmuşam. Ona görə də sizə nə danışsam, onu qəbul edin, lakin bilmədiyim bir şeyi məndən istəməyin." Sonra dedi: "Bir gün Allahın Rəsulu - salləllahu aleyhi və səlləm - Məkkə ilə Mədinə arasında olan Xum adlı yerdə bizə xütbə verdi. O, Allaha həmd etdi, Ona təriflər söylədi, insanları nəsihətləndirdi və xatırlatmalar etdi. Sonra belə buyurdu: “Ammə bəd, ey insanlar! Mən də bir insanam və çox keçməz ki, Rəbbimin elçisi yanıma gələr və mən də (onun çağırışına) cavab verərəm. Mən sizin aranızda iki ağır əmanət qoyub gedirəm: Birincisi,

---

[647] Şeyx Şueybin “Musnəd Əhməd” kitabında (17/171) əlavə etdiyi qeydə bax.

[648] İbn Əbi Asim, “əs-Sunnə”, 1558; ət-Tahavi, “Şərh Müşkil əl-Əsər”, (1760); Şeyx Şueyb isnadının həsən olduğunu deyir.

[649] Bax: əl-Busiri, “İthəful-Xiratil-Məhəra”, 7/210 (6683); İbn Həcər, “əl-Mətalibul-Aliyə”, 3943;

Allahın Kitabıdır. Onun içində hidayət və nur var. Allahın Kitabına sarılın və ondan möhkəm yapışın!' Allahın Kitabına sarılmağa təşviq etdi və ona rəğbətləndirdi. Sonra belə buyurdu: 'Və Əhli-Beytim! Əhli-Beytim haqqında sizə Allahı xatırladıram! Əhli-Beytim haqqında sizə Allahı xatırladıram! Əhli-Beytim haqqında sizə Allahı xatırladıram!' Bunun üzərinə Husayn ona dedi: "Ey Zeyd, onun Əhli-Beyti kimlərdir? Onun xanımları Əhli-Beytindən deyilmi?" Zeyd dedi: "Onun xanımları da Əhli-Beytindəndir, lakin Əhli-Beyti, ondan sonra sədəqə qəbul etməsi haram olanlardır." Husayn soruşdu: "Onlar kimlərdir?" Zeyd dedi: "Onlar Əli ailəsi, Aqil ailəsi, Cəfər ailəsi və Abbas ailəsidir." Husayn soruşdu: "Bütün bu şəxslər sədəqədən məhrumdurlar?" Zeyd dedi: "Bəli."[650] Səqaleyn hədisinin ən səhih və ən sağlam şəkli budur. Beləliklə də Allahın elçisi öz ümmətinə Allahın Kitabını və əhlul-beytini tərk edərkən Kitaba sarılmağı, ondan bərk-bərk yapışmağı və ona tabe olmağı əmt etmiş, əhlul-beytin isə qayğısına qalmağı, onları himayə etməyi, onların haqqını verməyi tapşırmışdır.

Hətta qarşıya qoyulan digər ləfzlərin səhih olduğunu qəbul etsək belə burada yenə də imamətə dair dəlil yoxdur. Bunun isə bir neçə yöndən izahı vardır. Hər şeydən əvvəl rəvayətdə keçən “itrət” sözünə baxmağımız lazımdır. Çünki “itrət” sözü ərəb dilində kişinin ən yaxın qohumlarını nəzərdə tutur. Xalil əl-Fərahidi deyir: “Kişinin itrəti; onun övladından, övladının övladından və ən yaxın əmi uşaqlarından olan qohumlarıdır.”[651] Şiə alimi Fəxruddin ət-Tureyhi ən-Nəcəfi yazır: “İtrət raht deməkdir və onlar Allahın elçisinin - salləllahu aleyhi va əlihi va səlləm - rahtıdır. Bir kişinin rahtı isə onun qövmü və qəbiləsidir.”[652] Hətta zeydi şiələrə hədisdəki “itrət” sözünü dəlil gətirdiklərində məşhur şiə alimi əl-Mufid buna etiraz edir. O, “əl-Məsəil əl-Cərudiyyə” kitabında deyir: “Cərudiyyə məzhəbi dedi: "Bizim imamətin yalnız Həsən və Hüseynə - aleyhiməssalam - və onların övladlarına məxsus olduğunu sübut edən bir dəlilimiz var, belə ki, o, möminlərin əmirinin - əleyhissalam - digər övladlarına, Bənu Haşimə və bütün insanlara aid edilmir. Bu dəlil Peyğəmbərin - salləllahu aleyhi və alih - bu sözləridir: 'Mən sizə iki şey qoyub gedirəm: onlara sarılsanız, heç vaxt azmazsınız. Allahın Kitabı və mənim itrətim – Əhli-Beytim. Onlar hovuzun kənarında mənə qovuşana qədər bir-birindən ayrılmayacaqlar.” İmamiyyə məzhəbi isə dedi: "Bu hədis, imamətin yalnız Fatimənin -

[650] “Sahih Muslim”, 2408

[651] “Kitəbul-Ayn”, 2/66;

[652] “Məcmə əl-Bəhreyn”, 3/116;

əleyhəssalam - övladlarında olmasını deyənlər üçün dəlil olmaqdan daha çox, onun bütün Bəni Haşimə aid olduğunu sübut edənlər üçün daha güclü bir dəlildir. Çünki heç bir ixtilaf yoxdur ki, Haşim oğullarının hamısı Peyğəmbərin - salləllahu aleyhi və alih - itrəti və əhlu-beytidir. Yoxsa siz əgər bu dəlili yozaraq onun yalnız Fatimənin - əleyhəssalam - övladlarına aid olduğunu iddia etsəniz, sizin rəqibləriniz olan imamiyyə şiələri də onu belə təfsir edə bilərlər ki, Fatimə övladları arasında (bu imamət) Hüseyndən və qardaşı Həsəndən - aleyhissələm - sonra yalnız Hüseynin - əleyhissələm - övladlarında davam etməlidir. Beləliklə, buna cavabınız olmaz."[653] Burada bizi maraqlandıran tərəf budur ki, əl-Mufid zeydi şiələrinə rəddiyyə verərkən qəbul edir ki, bütün bənu haşim əslində Peyğəmbərin - aleyhissalətu vassələm - itrəti və əhlu-beytidir. Müzakirəni davam etdirən əl-Mufid deyir: "Cərudiyyə məzhəbi dedi: "Dil baxımından *itrət* sözü *əsas, nüvə və xüsusi hissə* mənasını ifadə edir. Bunun nümunəsi olaraq *itrətul-misk* (ətirin itrəti) ifadəsi işlədilir ki, burada onun ən xüsusi və təmiz hissəsi nəzərdə tutulur. Buna əsasən, Peyğəmbərin - salləllahu aleyhi və alih - itrəti Haşim oğullarının hamısı yox, yalnız onun varisləridir." İmamiyyə məzhəbi isə dedi: "Bəli, Peyğəmbərin - salləllahu aleyhi və alih - itrəti onun özək və xüsusi varisləridir, sizin ətirlə bağlı gətirdiyiniz misal da bunu təsdiq edir. Lakin *burada özəl və xas şəxslər* dedikdə, bu yalnız övladları deyil, həm də qardaşları, əmiləri və əmioğlanlarını da əhatə edir. Əgər sizin dediyiniz kimi olsaydı, o zaman möminlərin əmiri (Əli) - əleyhissalam - Peyğəmbərin zürriyyətindən olmadığı üçün itrətdən kənar qalardı, halbuki o, imamların ağası və ən fəzilətlisidir. Bu isə ittifaq ilə batildir."[654] Beləliklə də əl-Mufid etiraf edir ki, itrət sözü məna etibarı ilə özündə bütün Haşim oğullarını cəm edir. Zeyd bin əl-Ərqam'ın hədisindən də anlaşıldığı kimi bura Əlinin ailəsi daxil olduğu kimi Aqil, Cəfər və Abbas'ın da ailəsi daxildir. əş-Şərif əl-Murtəda özü də bu həqiqəti görsə də mənanı başqa dəlillərə əsasən darlaşdırmağa çalışır. O deyir: "Əgər deyilsə ki, itrət deyilərkən nə nəzərdə tutulur? Çünki hökm bu ada bağlıdır və onun mənasını izah etmək lazımdır." Biz deyərik: "Ərəb dilində bir şəxsin itrəti onun nəsli, yəni övladları və nəvələri sayılır. Dil alimlərindən bəziləri bu mənanı genişləndirərək, itrətin bir şəxsin ona nəsəbcə ən yaxın olan qohumları olduğunu bildirirlər. Birinci rəyə görə, hədisin zahiri mənası və həqiqəti Həsən və Hüseynin - aleyhiməssalam - və onların övladlarını əhatə edir. İkinci

[653] əl-Mufid, "əl-Məsəil əl-Cərudiyyə", səh: 39-40;

[654] Eyni mənbə, səh: 40-41;

rəyə görə isə bu, bizim qeyd etdiyimiz şəxsləri və onlara nəsəb baxımından yaxın olanları əhatə edir. Üstəlik, Rəsulullah - salləllahu aleyhi və alih - şübhəni aradan qaldıracaq və məsələni aydınlaşdıracaq şəkildə sözünü bir qeydə bağlayıb. Belə ki, o, "itrətim əhlu-beytim" demiş və beləliklə də hökmü bu iki ada layiq olan şəxslərə yönəltmişdir. Biz bilirik ki, bir şəxsin itrəti arasında onun əhlu beyti sayılanlar yalnız bizim qeyd etdiyimiz kimi övladları, övladlarının övladları və yaxın qohumluqda onların məcrasını tutan şəxslərdir. Bundan əlavə, Rəsulullah - salləllahu aleyhi və alih - əhlul-beyt olmaq vəsfinin kimlərə aid olduğunu özü izah etmişdir. Hədislər təzahür etmişdir ki, O möminlərin əmirini, Fatiməni, Həsəni və Hüseyni - aleyhimussalam - evinə toplamış, onları örtüyü ilə örtmüş və sonra belə dua etmişdir: "Allahım! Bunlar mənim Əhli-Beytimdir. Onlardan hər cür pisliyi uzaq et və onları tərtəmiz et!" Bundan sonra ayə nazil olmuşdur. Ümmü Sələmə dedi: "Ey Allahın Rəsulu! Mən sənin Əhli-Beytindən deyiləmmi?" O buyurdu: "Xeyr, lakin sən xeyir üzərindəsən." Beləliklə, bu adı başqalarına deyil, məhz onlara məxsus qılmışdır. Buna görə də hökmün onlara və dəlillə əsasən onların sırasına daxil olanlara yönəlmiş olması lazımdır. Həmçinin, bu hökmü onlar üçün sabit görən hər kəs - yəni, onlara sarılmağın və onlara tabe olmağın vacib olduğunu qəbul edənlər - onların övladlarının da bu məsələdə onlarla eyni mövqedə olduqlarını bildirmişlər. Beləliklə, hökmün onların hamısına aid olduğu sabit olmuşdur."[655] əş-Şərif əl-Murtəda çox gözəl başa düşür ki, bu hədis ləfz olaraq, yəni ərəb dilində dəlalət etdiyi məna baxımından on iki imamın imamlığına dəlalət etmir. İtrət sözünə lüğət baxımından Peyğəmbərin övladları ilə yanaşı əmiləri və əmioğullarının da daxil olduğunu anlayır, lakin qeyd edir ki, hədisdə bütün itrət yox, xüsusilə əhlul-beyt nəzərdə tutulub. Daha sonra əhlul-beyti məşhur Kisə hədisi ilə Əliyə, Fatiməyə, Həsənə və Hüseynə xas qılır, geridə qalan imamların isə başqa dəlillərə əsasən müəyyən edilə biləcəyini deyir. Maraqlıdır ki, əş-Şərif müzakirəsində seyyidə Fatimənin əhlul-beytdən olması baxımından hədisi imamətlə necə uzlaşdırmağın mümkünlüyünü heç bir yerdə izah etmir. Əgər səqaleyn hədisi imamətə dəlalət edirsə o zaman seyyidə Fatimənin də imam olması lazımdır ki, şiələr özləri belə bunu qəbul etmirlər. Biz burada arqument olaraq "əhlul-beyt" adının xüsusiləşdirilməsinə qarşıda baxacağıq,

---

655 əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İmamə", 3/123; Muhəmməd Hüsen əd-Dirayəti'nin təhqiqində isə 4/462-463-cü səhifəyə bax.

çünki əhlul-beyt deyildikdə Kisə hədisi və Təthir ayəsi aktuallaşır. əş-Şərif özü də gördüyümüz kimi bunları dəlil gətirir.

Qeyd etməliyik ki, əş-Şərif əl-Murtəda'nın bu müzakirədəki müqabili əl-Qadi Abdulcabbar öz etirazında haqlıdır. Beləki əl-Qadi səqaleyn hədisinin dəlaləti haqqında deyir: “Bu isə yalnız itrətin icmasının haqq olacağını göstərir, çünki Peyğəmbər - salləllahu aleyhi və səlləm - bununla ya onların hamısını, ya da hər birini ayrılıqda nəzərdə tutmuş ola bilər. Biz bilirik ki, Peyğəmbər - salləllahu aleyhi və səlləm - yalnız onların hamısını bütövlükdə nəzərdə tuta bilər, çünki onlardan hər birini ayrıca nəzərdə tutması mümkün deyil. Çünki sözün quruluşu cəmi ifadə edir, tək-tək fərdləri deyil. Həmçinin, onların vəziyyətini bildiyimiz üçün onların arasında fikir ayrılığının baş verə biləcəyini də bilirik. Hər birinin sözünün haqq olması mümkün deyil, çünki haqq bir şeydə və onun əksində eyni anda ola bilməz. Onların belə fikir ayrılığına malik olmalarına baxmayaraq Kitabdan ayrılmadıqlarını söyləmək də mümkün deyil. Bütün bunlar hədisin mənasının onların icması barədə olduğunu təsdiqləyir. Yəni, onların üzərində ittifaq etdikləri şey haqqdır, belə ki, Peyğəmbərin - salləllahu aleyhi və səlləm - "Onlar hovuzun yanında mənə qovuşana qədər bir-birindən ayrılmayacaqlar" sözünün doğruluğu təsdiqlənmiş olur. Bu isə hədisin imamətə aid edilməsini mümkünsüz edir, çünki imamət onların hamısına aid ola bilməz, o, yalnız onlardan birinə məxsus ola bilər.”[656] Həqiqətən də bu hədisin bəzi variantlarında keçən “onlar hovuzun kənarında mənə qovuşana qədər bir-birindən ayrılmayacaqlar” ləfzi və buna bənzər ifadələr heç bir şəkildə imamətin və xilafətin müəyyən bir şəxsdə olduğuna dəlalət etmir. Nəinki bu, hətta əhlul-beytdən - Peyğəmbər - salləllahu aleyhi va alə əlihi va səlləm - istisna olmaqla - heç kimin təklikdə hüccət olduğuna dəlalət etmir. Bu hədis alimlər arasındakı müzakirələrdə əsasən itrətin, yəni əhlul-beytin hüccətinin icma olub olmaması yönündə dəlil gətirilib. İtrətin icmasını hüccət hesab edənlər əsasən bu hədisə əsaslanırlar.. Çox qəribədir ki, əhlüs-sünnətin içində böyük əksəriyyət əhlul-beytin icmasını hüccət olaraq qəbul etmədiyi halda bunun hücciyyətini müdafiə etməklə tanınmış alim Şeyxul-İslam İbn Teymiyyə olub. O, fətvalarının birində yazır: “İmam Əhmədin əshabından və başqalarından olan alimlər xəlifələrin icmasının və Əhli-Beytin icmasının hüccət olub-olmaması barədə ixtilaf etmişlər; tabe olunması vacib bir hüccətdirmi? Səhih olan budur ki, hər

[656] əl-Qadi Abdulcabbar, “əl-Muğni”, 20/191-192;

ikisi də hüccətdir."[657] Bu rəy həmçinin hənbəlilərdən əl-Qadi Əbu Yalə'nin rəyidir. Təqiyyuddin əl-Cərrai əl-Hənbəli yazır: "əl-Qadi (Əbu Yalə) "əl-Mutəməd" kitabında, bəzi alimlər və şiələr deyiblər ki, itrət xəta üzərində icma etməzlər."[658] Beləliklə də əl-Qadi Əbu Yalə və bəzi alimlər bu rəydə olublar ki, əhlul-beyt xəta və zəlalət üzərində icma etməzlər; əgər onlar bir rəy üzərində icma ediblərsə deməli bu rəy doğru olmalıdır. Lakin məsələnin mehvəri burada əhlul-beytin kimlər olmasıdır. Ona görə də İbn Teymiyyə səqaleyn hədisi ilə bağlı verdiyi açıqlamada buyurur: "Bu hədisi Tirmizi rəvayət etmiş və ona bu əlavəni əlavə etmişdir: 'Və onlar hovuzun kənarında mənə qovuşana qədər ayrılmayacaqlar.' Hafizlərdən birdən çoxu bu əlavə barədə irad bildirmiş və onun hədisin bir hissəsi olmadığını söyləyiblər. Bu əlavənin səhih olduğuna inananlar isə deyiblər ki, bu sadəcə olaraq ona dəlalət edir ki, itrətin hamısı - və onlar Haşim oğullarıdır - zəlalət üzərində ittifaq etməzlər. Bunu sünnət əhlindən bir qrup deyib və bu, əl-Qadi Əbu Yalə'nın və başqalarının cavablarındandır."[659] Anlaşıldığı kimi səhih qəbul edildiyi halda oradan çıxarıla biləcək ən uzaq məna əhlul-beytin icmasının hüccət olmasıdır, əhlul-beytin fərdlərinin ayrılıqda hüccət olmasına heç bir şəkildə dəlalət etmir.

Bu nöqtə öz təsdiqini tapdıqdan sonra əş-Şərif əl-Murtəda'nın ikinci addımına baxaq, çünki iddiasına görə Peyğəmbərin əhlul-beyti Əlinin imam olmasında icma edib. Biz isə deyirik ki, əhlul-beytin icma etdiyi elə bir məsələ yoxdur ki, sünnət əhli o məsələdə onların icmasına müxalif olsun. Əksinə görürük ki, imami şiələrinin üsulud-din hesab etdikləri məsələlərdə Peyğəmbərin itrəti ixtilaf ediblər. İxtilaf etdikləri məsələlər arasında - əş-Şərif əl-Murtəda'nın dediyinin əksinə - imamət məsələsi də olub, beləki əhlul-beytin böyüklərinin - xüsusilə də əl-Həsənin övladlarının - iddia olunan imam etiqadından xəbərləri olmayıb. Təbii ki, əş-Şərif əl-Murtəda bununla razılaşmır və belə bir iddianı qəbul etməyərək deyir:

"Əgər deyilsə ki, "Əhli-Beytin bu məsələdə icma etdiyini necə iddia edirsiz, halbuki onların çoxunun imamət məsələsində mötəzilə məzhəbinə meyl etdiyini görürük?" Biz deyərik: "Biz Əhli-Beytdən heç kimin bizim qeyd etdiyimiz şeyə müxalif olduğunu görməmişik. Keçmişdə dediklərimizə zidd bir şey söylədiyi nəql edilən kəslərin

---

[657] İbn Teymiyyə, "Məcmu əl-Fətəva", 2/580;

[658] əl-Cərrai, "Şərh Muxtəsar Usul-Fiqh", 1/607;

[659] İbn Teymiyyə, "Minhəcus-Sunnə ən-Nəbəviyyə", 7/318;

hamısı - əgər bu onlardan səhihdirsə - sözləri ilə icmaya qarşı etiraz olaraq gətirilən kəslərdən daha yaxşı halda deyildir, çünki şazz qalıblar. Bu görüşün aid edildiyi şəxslər çox vaxt bir-iki şəxsdir ki, belə bir şey icmaya qarşı dəlil sayılmaz. Bundan əlavə, onların arasında bu fikrə sahib olduğu deyilənlər arasında nə Əhli-Beytin alimlərindən, nə də fəzilət sahiblərindən kimsəni tapa bilməzsən. Əksinə belə birinin halını təftiş etsən onun məsələyə müəyyən dünyəvi məqsədlərlə yanaşan və ondan dünyəvi mənfəət əldə etməyə çalışan biri olduğunu görəcəksən. Əgər biz şazz və tək-tük fərdlərin etirazlarını camaatlara qarşı qəbul etsək, bu, heç bir şeydə icmanın sabit olmamasına gətirib çıxarar, çünki biz bilirik ki, ğulat və ismaililər arasında namaz rükunlarının sayından tutmuş başqa şəriət məsələlərinə qədər bir çox məsələdə müxalif olanlar var. Hətta onların bəziləri Peyğəmbərdən - salləllahu aleyhi və alih - sonra bir neçə peyğəmbərin gəldiyini və onunla peyğəmbərliyin sona çatmadığını belə iddia etmişlər. Lakin bu, bizim peyğəmbərliyin sona çatması və şəriət əsaslarının sabit olması barədə icma etməyimizə mane olmur və bu fərqli rəylər nəzərə alınmır. Məlumdur ki, bu şəxslərin sayı əhlul-beytdən imamət məsələsində bizim qeyd etdiyimizəə zidd bir şey söyləyənlərin sayından qat-qat çoxdur."[660]

əş-Şərif əl-Murtəda'nın qarşıya qoyduğu arqument çox bəsitdir və anlaşılması asandır. Deyir ki, səqaleyn hədisi əhlul-beytin icmasının hüccət olduğunu isbat edib. Daha sonra əlavə edir ki, əhlul-beyt icma edib ki, Əli bin Əbi Talib - radiyallahu anhu - Peyğəmbərdən - aleyhissalətu vassələm - sonra dərhal xəlifə olması ilahi təyinat ilə müəyyən edilmiş bir imamdır. Belə bir icmanın baş vermədiyini iddia edənlər qarşı isə buyurur ki, əhlul-beytdən bu məsələdə müxalif olanlar sayca çox az olublar, əhlul-beytin böyükləri olmayıblar və dünya əhli olublar. əş-Şərif'in sözlərinin doğruluğunu və ağırlığını biz tarixi dəlillər süzgəcindən keçirməliyik. Çünki yalnız bu şəkildə biz verilmiş cavabın nə qədər tutarlı olub olmadığını deyə bilərik.

Həqiqət budur ki, əhlul-beyt bu məsələdə böyük çoxunluqda imamət etiqadından uzaq olublar. Hətta biz desək ki, əhlul-beyt əş-Şərif əl-Murtəda'nın etiqadının əksinə icma edib daha isabətli olarıq. İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında deyir: "Şubəbə bin Səvvar əl-Fəzəri bizə xəbər verdi; əl-Fudeyl bin Mərzuq mənə xəbər verdi: "əl-Həsən bin əl-Həsəni onların haqqında aşırılığa varan birinə belə deyərkən

---

[660] əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İmamə", 3/126-127; Muhəmməd Hüsen əd-Dirayəti'nin təhqiqində isə 4/467-468-ci səhifəyə bax.

eşitdim: "Sizə vay olsun! Bizi Allah üçün sevin! Əgər Allaha itaət etsək bizi sevin, əgər Allaha asi olsaq bizə nifrət edin!" Həmin adam ona dedi: "Siz Allahın elçisinin qohumları və əhli beytisiz." (əl-Həsən) dedi: "Vay olsun sənə! Əgər Allaha kiməsə heç bir itaəti olmadan sadəcə Allahın elçisinə - salləllahu aleyhi va səlləm – qohumluğuna görə fayda versəydi o zaman ona bizdən də daha yaxın olanlara, atasına və anasına fayda verərdi. Allaha and olsun ki, içimizdə ası olana iki qat əzab veriləcəyindən narahatam və içimizdən yaxşı əməl sahibinə isə iki qat əcr veriləcəyinə ümid edirəm. Veyl olsun sizə, Allahdan qorxun və bizim haqqımızda haqqı deyin, bu, istədiyinizə daha tez çatdırar və biz sizdən buna görə razı olarıq." Sonra dedi: "Əgər sizin bu dedikləriniz Allahın dinindəndirsə o zaman atalarımız bizə həqiqətən pislik ediblər, çünki bizə onları öyrətməyiblər və bizi onlara təşviq etməyiblər." Həmin rafizi ona dedi: "Məgər Allahın elçisi – aleyhissələm – Əliyə deməyibmi ki, "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır"? Dedi: "Allaha and olsun ki, əgər bununla əmirliyi və səltənəti qəsd edirdisə o zaman daha aydın şəkildə ifadə edərdi, necəki namazı, zəkatı, ramazan orucunu və Allahın evini həcc etməyi onlara açıq şəkildə öyrədib. O zaman deyərdi: "Ey insanlar, bu, məndən sonra sizin əmr sahibinizdir." Çünki insanlara ən çox qayğı göstərən kəs Allahın elçisi - salləllahu aleyhi va səlləm – idi. Əgər məsələ sizin dediyiniz kimi olsaydı, yəni Allah və rasulu Əlini peyğəmbərdən – aleyhissələm - sonra insanlara başçılıq etmək üçün seçmişdisə o zaman Əli özü bu işdə insanlar arasından xətası və günahı ən böyük olandır, çünki Allahın elçisinin – salləllahu aleyhi va səlləm – ona əmr etdiyini əmr etdiyi şəkildə yerinə yetirmədi və ya insanlara bu işdə üzrünü ifadə etmədi."[661] əl-Beyhəqi "əl-İtiqad" kitabında bu rəvayətin bir hissəsini həm Şubəbə bin Səvvar, həm də Cəfər bin Aun yolu ilə rəvayət edir.[662] Həmçinin tarixçi, nəssəb Musab bin Abdilləh əz-Zubeyri "Nəsəbu Qureyş" kitabında bunun bir hissəsini əl-Fudeyl bin Mərzuq'dan rəvayət edir.[663] əl-Mizzi "Təhzibul-Kəməl" kitabında Şubəbə yolu ilə gələn bu rəvayəti qeyd edir və deyir: "Bu, ən səhih və ən qısa isnadlardandır."[664] əl-Fudeyl bin Mərzuq şiə olsa da alimlərimiz onu siqa, saduq hesab ediblər. Bunu ondan rəvayət edən Şubəbə bin Səvvar, Cəfər bin Aun, Musab bin Abdilləhin hamısı siqadır. Burada bu sözləri deyən zat əl-

---

661 İbn Sad, "ət-Tabəqat əl-Kubra", 5/319, Sadir

662 əl-Beyhəqi, "əl-İtiqad", səh: 355;

663 "Nəsəbul Qureyş", səh: 49;

664 əl-Mizzi, "Təhzibul-Kəməl", 6/88;

Həsən bin əl-Həsən əl-Musənnə bin əl-Həsən əs-Sibt bin Əli bin Əbi Talib'dir. Yəni peyğəmbərin – salləllahu aleyhi va səlləm – reyhan qoxulu nəvəsi Həsənin eyni adlı nəvəsidir. Anası atasının əmisi qızı Fatimə bint əl-Hüseyn bin Əli bin Talib'dir, yəni hər iki tərəfdən əhlul-beytdəndir, əhlul-beytin imamlarındandır. İbadəti və zühdü ilə tanınması ilə yanaşı zalımlara qarşı haqq sözünü deməkdən çəkinməzdi. Abbasi xəlifəsi əl-Mənsur onu qardaşları və tələbələrindən bir qrup ilə birlikdə Mədinə şəhərindən götürərək ayaqları qandallı şəkildə İraqdakı Haşimiyyə məhbusxanasına gətirib orada həbs edir. Hicri 145-ci ildə o həbsdə 68 yaşında vəfat edir. Gördüyümüz kimi dünya əhlindən olmayıb, əksinə əhlul-beytin böyüklərindən olub.

Şiə qaynaqları da bunu təsdiqləyir. əl-Kəşşi ricəl kitabında isnadı ilə rəvayət edir ki, Süleyman bin Xalid yolda əl-Həsən bin əl-Həsən ilə qarşılaşır və (əl-Həsən) ona deyir: "Məgər bizim haqqımız yoxdur? Məgər bizim hörmətimiz yoxdur? Bizdən bir nəfəri seçdinizsə artıq kifayət edir?"...[665] Bu rəvayət ona dəlalət edir ki, İmam əl-Həsən'in nəvəsi iddia olunan imamlıq inancından xəbərsiz olub. Həmçinin əhlul-beytin, itrətin ən böyük nümayəndələrindən olan Zeyd bin Əli də bundan xəbərsiz idi. Yenə əl-Kəşşi isnadı ilə rəvayət edir ki, İsmail bin Abdilxaliq xəbər verir ki, İmam Cəfər əs-Sadiq'in hüzurunda ikən Əbu Cəfər əl-Əhval'dan soruşurlar: "Əbu Abdilləhin hüzurunda səninlə Zeyd bin Əli arasında nə baş verdi?" Dedi: "Zeyd bin Əli soruşdu: "Ey Muhəmməd bin Əli, mənə çatan xəbərə görə sən Muhəmmədin ailəsində itaəti fərz olan bir imamın olduğunu iddia edirsən?" Dedim: "Bəli və atan Əli bin əl-Hüseyn onlardan biri idi." Dedi: "Axi necə?! Mənə bir loqma verildikdə, çox isti olanda onu əli ilə soyudardı və mənə yedirərdi. Səncə onun mənə loqmanın istiliyindən ürəyi yandı da, amma cəhənnəmin istisindən ürəyi yanmadı?! Ona dedim: "İstəmədi ki, sənə xəbər versin və sən küfr edəsən, beləliklə də sənin üçün nə şəfaət, nə də məşiyyət çarə olsun!..."[666] əl-Kuleyni də eyni şəkildə rəvayət edir ki, Əbən deyib: "Əl-Əhval mənə xəbər verdi ki, Zeyd bin Əli bin Hüseyn (əleyhissəlam) ona gizləndiyi zaman xəbər göndərdi. Əl-Əhval dedi: Mən onun yanına getdim və o mənə dedi: "Ey Əbu Cəfər! Əgər bizdən birindən sənə bir çağırış gəlsə, onunla birlikdə çıxarsanmı?" Mən dedim: "Əgər atan və ya qardaşın olsa, onunla çıxaram." O dedi: "Mən çıxıb bu insanlarla cihad etmək istəyirəm,

[665] ət-Tusi, "İxtiyər Mərifətir-Ricəl", 2/363; Muəssəsətus-Sadiq, 1440/2019; Ravilərin hamısı şiə ricəl alimlərinə görə siqadır.
[666] ət-Tusi, "İxtiyər Mərifətir-Ricəl", 2/13; Ravilərin hamısı şiələrə görə siqadır.

mənimlə birlikdə çıx." Mən dedim: "Xeyr, bunu etmərəm, canım sənə fəda olsun." O dedi: "Sən öz nəfsini mənə qıymırsan?" Mən dedim: "Bu, tək bir candır. Əgər yer üzündə Allahın hüccəti varsa, o zaman sənə qoşulmayan nicat tapar, amma sənə qoşulan olar. Əgər yer üzündə Allahın hüccəti yoxdursa, o zaman sənə qoşulmayanla sənə qoşulan eyni vəziyyətdədir." O dedi: "Ey Əbu Cəfər! Mən atamla bir süfrədə otururdum. O, mənə yağlı tikələri verirdi və mənə şəfqətlə isti loğmaları soyudurdu ki, mənim üçün rahat olsun. Amma o, məni cəhənnəm atəşindən qorumağa şəfqət göstərməyib; sənə dini xəbər verib, amma mənə bildirməyib?" Mən dedim: "Canım sənə fəda olsun! Onun sənə dini bildirməməsi sənin atəşə düşməyindən qorxduğu üçün idi. O, qorxurdu ki, qəbul etməzsən və cəhənnəmə düşərsən. Amma mənə bildirdi, çünki mən qəbul etsəm, nicat taparam, qəbul etməsəm, mənim cəhənnəmə düşməyim onun üçün fərq etməzdi."[667] Məlumdur ki, Əbu Cəfər əl-Əhval'ın Zeydə verdiyi cavabın bir quruşluq belə dəyəri yoxdur.[668] Bizim üçün önəmli olan Zeydin mövqeyidir və onun bu mövqeyinə şahidlik edən tarixi xəbərlər çoxdur.

Hətta Muhəmməd Asif Muhsini etiraf etməli olur ki, "imamət və on iki imam məsələsi Haşim oğulları nəzdində, əl-Həsənin oğulları və əl-Hüseynin oğulları arasından böyük bir qrupun nəzdində musəlləm deyildi..."[669] Yəni imamət məsələsi əhlul-beytin ciddi bir hissəsi tərəfindən qəbul olunmurdu, onlar əhlul-beyt içərisində itaət olunması vacib olan məsum imamların olduğuna inanmırdılar. Kitablarda səhih isnadlarla keçən bir çox rəvayət bunu təsdiqləyir. Onlardan birini İbn Sad "ət-Tabəqat" kitabında rəvayət edir və deyir: "Şubəbə bin Səvvar bizə xəbər verdi; dedi: Fudeyl bin Mərzuq bizə xəbər verdi; dedi: "Cəfər (əs-Sadiq)in iki əmisi Ömər bin Əli və Hüseyn bin Əli'yə sual verdim: "Siz əhlul-beytdə itaəti fərz olan elə bir insan varmı ki, onu tanıyasız və

---

667 əl-Kuleyni, "əl-Kafi", 1/174; əl-Məclisi "Miratul-Uqul" kitabında (2/277) isnadı barəsində "səhih kimi muvassaqdır" hökmünü verir.

668 Əbul-Qasim əl-Xoyi "Mucəm Ricəl əl-Hədis" kitabında (8/367) əl-Əhval'ın verdiyi cavab haqqında deyir: "Bu fikir qəti şəkildə batildir. Bunun izahı belədir: Əl-Əhval fəzilətli və seçilmiş şəxslərdən idi, o, imamətin məqamını və onun xüsusiyyətlərini yaxşı bilirdi. O halda, necə ola bilər ki, o, Səccad (əleyhissəlam) haqqında belə bir söz söyləsin ki, o, Zeydə - ona olan şəfqətinə görə - özündən sonrakı imamı bildirməmişdir? Məgər nəsil bağlılığına görə bir şəfqət səbəbi ilə imaməti gizlətmək caizdirmi?! Bundan əlavə, əgər Zeyd - Allah eləməsin - Səccadın - əleyhissəlam - özündən sonrakı imamı bildirəcəyi təqdird onu qəbul etməyəcək bir adam olsaydı, o zaman o, haqqa qarşı müxalif olanlardan (müanidlərdən) olardı. Bu halda, necə ola bilər ki, imamın ona şəfqət göstərməsi məqbul olsun?!"

669 Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 2/173; Muəssəsətul-Arif, Beyrut, 1426/2005

hər kim onu tanımazsa, bu hal üzrə ölərsə cahiliyyə ölümü ilə ölər?" Hər ikisi də dedi: "Xeyr, Allaha and olsun, bizdə belə biri yoxdur. Kim bizdə belə birinin olduğunu iddia edərsə o, yalançıdır. (Fudeyl) dedi: "Ömər bin Əliyə dedim: "Onlar iddia edirlər ki, bu mərtəbə Əliyə aid idi, peyğəmbər - salləllahu aleyhi va səlləm - bunu ona vəsiyyət edib. Sonra Həsənə aid olub; Əli bunu ona vəsiyyət edib. Sonra Hüseynə aid olub, Həsən bunu ona vəsiyyət edib. Sonra Əli bin Hüseynə aid olub, Hüseyn bunu ona vəsiyyət edib. Ondan sonra isə Muhəmməd bin Əliyə aid olub, Əli (bin Hüseyn) ona vəsiyyət edib." Dedi: "Allaha and olsun ki, atam öldükdə iki hərf belə vəsiyyət etməyib. Allah onları məhv etsin! Onlar bizi satıb hesabımıza yaşayan kəslərdir. Budur Xuneys əl-Xur, bilirsən Xuneys əl-Xur nədir?! Dedim: "əl-Muallə bin Xuneysi qəsd edirsən?" Dedi: "Bəli, əl-Muallə bin Xuneys. Allaha and olsun ki, yatağımda uzanıb çoxca fikirləşdim və bu qövmün halına təəccübləndim ki, əl-Muallə bin Xuneys kimi birisinin azdıra biləcəyi dərəcədə Allah - azzə va cəllə - ağıllarını qarışdırıb."[670] Bunu həmçinin İbn Asim kiçik bir hədis cüzündə də eyni sənədlə rəvayət edir.[671] İbn Əbi Xeysəmə deyir: "Musab bizə xəbər verdi; dedi: "Ömər bin Əli bin Hüseynə soruşdular: "Siz əhli beytin içində itaəti fərz olan bir insan varmı?" Dedi: "Xeyr, Allaha and olsun ki, bizdə belə biri yoxdur. Bunu deyən yalançıdır." Ona vəsiyyəti zikr etdim və dedi: "Allaha and olsun ki, atam öləndə iki hərf belə vəsiyyət etmədi. Allah onları məhv etsin. Onlar bizi satmaq hesabına yaşayırlar."[672] Musab bin Abdilləh isə Fudeyl bin Mərzuq'dan hədis rəvayət etmiş alimlərimizdəndir. İmam əd-Dəraqutni deyir: "Əhməd bin Muhəmməd bin İsmail əl-Adəmi bizə rəvayət etdi; dedi: Muhəmməd bin əl-Hüseyn əl-Huneyni bizə xəbər verdi; dedi: Məxləd bin Əbi Qureyş ət-Tahhən bizə xəbər verdi; dedi: Abdulcabbar bin Abbas əl-Həmədəni bizə xəbər verdi ki, onlar Mədinə şəhərindən çıxıb yola düşməyə hazırlaşdıqlarında Cəfər bin Muhəmməd onların yanına gəldi və dedi: "Siz - inşallah - öz ölkənizin saleh kəslərindənsiz, ona görə də onlara məndən xəbər çatdırın ki, hər kim mənim itaəti fərz olan bir imam olduğumu iddia edərsə mən ondan bəriyəm və mənim Əbu Bəkr və Ömərdən bəraət etdiyimi iddia edərsə mən ondan bəriyəm."[673]

---

[670] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 5/324-325; Dar Sadir

[671] "Cuz Muhəmməd bin Asim əs-Səqafi", səh: 124-125; Darul-Asimə, Riyad, 1409;

[672] İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 2/916; Dar əl-Faruq, Qahirə, 1427

[673] əd-Dəraqutni, "Fədail əs-Sahabə", səh: 88 (rəq: 65); Məktəbə əl-Ğurabə əl-Əsəriyyə, Riyad, 1419;

Məlumdur ki, Zeyd bin Əli hicri 122-ci ildə Kufə şəhərində əməvi xəlifəsi Hişəm bin Abdilməlikə qarşı üsyan etmiş, xəlifəlik məqamına iddia etmiş və bu yolda şəhid edilmişdi. əl-Kuleyni'nin rəvayətinə görə Zeyd ilə qardaşı əl-Baqir arasında belə bir dialoq keçib: "Zeyd o anda (qardaşına) qəzəbləndi və dedi: 'İmam, evində oturub pərdələri çəkərək cihaddan çəkindirən şəxs deyil. Əksinə, bizim aramızda olan imam, öz camaatını qoruyan, Allah yolunda haqq cihadla mübarizə aparan, xalqını müdafiə edən və onların namusunu qoruyandır."[674] Həmçinin İmam əl-Həsən əl-Muctəba'nın nəticəsi ən-Nəfs əz-Zəkiyyə ləqəbi ilə tanınmış Muhəmməd bin Abdilləh hicri 145-ci ildə Mədinə şəhərində abbasi xəlifəsi Əbu Cəfər əl-Mənsura qarşı üsyan etmiş və öldürülmüşdür. Əbul-Fərəc əl-Əsbəhəni onunla bağlı yazır: "Onun ailəsi ona Mehdi deyirdi və onun rəvayətlərdə haqqında danışılan şəxs olduğuna inanırdılar. Əbu Talibin ailəsinin alimləri onun 'Təmiz Nəfs' (*ən-Nəfs əz-Zəkiyyə*) və 'Həccər əz-Zeyt' adlanan yerdə öldürüləcək şəxs olduğunu düşünürdülər. O, ailəsinin ən yaxşısı və Qur'anı bilmə, onu əzbərləmə, din haqqında fəhmi, cəsarəti, səxavəti, qüvvəsi və ona yaraşan bütün məsələlərdə zamanının ən biliklisi idi. Heç kəs onun Mehdi olduğuna şübhə etmirdi və bu inanc xalq arasında geniş yayıldı. Bütün Bəni Haşimdən, o cümlədən Əbu Talibin və Abbasın nəslindən olan kişilər ona beyət etdilər."[675] Görünür ki, əhlul-beytin böyüklərindən olan ən-Nəfs əz-Zəkiyyə imamət etiqadından xəbərsiz idi. Ona qoşulub onun yanında vuruşanların arasında Cəfər əs-Sadiq'in övladları da olub. əl-Əsbəhəni deyir: "Əli bin əl-Abbas əl-Məqani bizə xəbər verdi; Bəkkar bin Əhməd bin əl-Yəsa bizə xəbər verdi; dedi: əl-Həsən bin əl-Hüseyn mənə əl-Hüseyn bin Zeyd'dən belə rəvayət etdi: "Hüseyn'in oğullarından dörd nəfər Muhəmməd bin Abdilləh bin əl-Həsənə qoşuldu: Mən, qardaşım İsa və Cəfər bin Muhəmməd'in iki oğlu Musa və Abdullah idi."[676]

---

[674] əl-Məclisi, "Mirətul-Uqul", 4/114;

[675] əl-Əsbəhəni, "Məqatil ət-Talibiyyin", səh: 207;

[676] əl-Əsbəhəni, "Məqatil ət-Talibiyyin", səh: 244 və 333;

## Əhlul-Beyt kimdir?

Saqaleyn hədisində əhlul-beytin zikri keçdiyi üçün burada mütləq onların kimlər olduğuna baxmağımız lazımdır. əş-Şərif əl-Murtəda'nın gətirdiyi arqumentdə Səqaleyn hədisindəki əhlul-beyt məfhumunu dar çərçivəyə salmağa çalışdığına şahid olduq. Əlbəttə ki, əhlul-beytin kimliyini öyrənmək üçün hər şeydən əvvəl Allahın kitabına müraciət etməliyik. əl-Əhzab surəsində Allah - cəllə cələluhu - Peyğəmbərin zövcələrinə xitab edərək buyurur: "Evlərinizdə qərar tutun! İlk cahiliyyə dövründə olduğu kimi açıq-saçıq gəzməyin. Namaz qılın, zəkat verin, Allaha və Onun Elçisinə itaət edin. Ey əlhul-beyt! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir. Evlərinizdə oxunan Allahın ayələrini və hikməti yada salın. Həqiqətən, Allah Lütfkardır, (hər şeydən) Xəbərdardır."[33:33-34] Bu, məşhur təthir ayəsidir. əş-Şərif əl-Murtəda da öz iddiasını isbat etmək üçün təthir ayəsini kisə hədisi ilə birlikdə gətirmişdi.

Şiələr bu ayəni imamların fəziləti və onların məsumluğuna dair dəlil olaraq göstərirlər. Lakin əhlüs-sünnət qeyd edir ki, ayə ümumiyyətlə hamıdan qabaq Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqında nazil olmuşdur, çünki ayənin əvvəli və sonrası aşkar şəkildə Peyğəmbərin zövcələrinə xitab edir. Ayə həmçinin məna cəhətdən də buna uyğundur, çünki Allah - cəllə cələluhu - Peyğəmbərin xanımlarını təmizləmək üçün, onları pak etmək üçün onlara əmrlər verir, onlara bəzi şeyləri qadağan edir. Başqa cür desək Allahu təalə Peyğəmbərin xanımlarına bəzi işləri qadağan edib, digərlərini əmr edərkən bunu onları günahlardan təmizləmək və onları paklamaq üçün etdiyini deyir. Burada əhlul-beyt sözü ilə hamıdan qabaq Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələrinin qəsd olunması İbn Abbasın sözlərində öz təsdiqini tapıb. Əbu Tahir əl-Muxallis (vəfatı h. 323) deyir: "Abdullah bizə rəvayət etdi; Əli ibn Hərb bizə rəvayət etdi; Zeyd ibn Habbab bizə rəvayət etdi; Hüseyn ibn Vaqid mənə Yezid ən-Nəhvi vasitəsilə İkrimədən, o da İbn Abbasdan rəvayət etdi: "Həqiqətən, Allah sizdən, ey Əhli-Beyt, yalnız günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir." İbn Abbas dedi: "Bu ayə xüsusilə Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqında nazil olmuşdur." İkrimə dedi: "Kim istəsə, bu ayənin Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqında nazil olması barəsində mübahələ etməyə

hazıram."[677] İbn Kəsir də deyir ki, İbn Əbi Hətim ər-Razi bunu kitabında Əli bin Hərb əl-Məvsili vasitəsilə eyni isnadla və eyni mətnlə rəvayət edir.[678] əz-Zəhəbi bu rəvayəti qeyd etdikdən sonra yazır: "İsnadı salehdir və ayələrin məzmunu da buna dəlalət edir."[679] əş-Şəvkəni deyir ki, "bunun bənzərini İbn Mərdəveyh Said bin Cubeyr yolu ilə İbn Abbas'dan rəvayət edib."[680] Beləliklə də ayələrin, o cümlədən təthir ayəsinin Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqında nazil olması isnad baxımından İbn Abbas'dan sabitdir. Əhlüs-sünnət alimlərinin təfsiri də bu izaha uyğun bir şəkildədir.

İmam əş-Şafi'dən (h. 204) bu barədə soruşurlar və peyğəmbərin yoldaşlarının ayəyə daxil olduğunu deyir.[681] Əbu Bəkr əl-Cəssas (h. 370) ayəni izah edərkən deyir ki, "bu ayəyə peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri daxildir, çünki xitabın əvvəli onlara aiddir."[682] Əbu Amr əd-Dəni (h. 444) deyir ki, ayə ilə "nəzərdə tutulan onun əhli-beyti olan zövcələri və ailəsidir."[683] Böyük ərəb dili alimlərindən İbn Sidəh əl-Mursi (v. h. 458) yazır ki, "Peyğəmbərin - salləllahu aleyhi va səlləm - Əhli-Beyti onun zövcələri, qızları və kürəkəni – yəni Əli - aleyhissələm -dır. Başqa bir rəvayətə görə, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - Əhli-Beyti onun zövcələri və onun ailəsindən olan kişilərdir."[684] Əbul-Muzaffər əs-Səmani (v. h. 489) deyir: "Şiələr iddia etmişlər ki, Allah-Təalanın dediyi {Ey Əhli-Beyt! Həqiqətən, Allah sadəcə olaraq sizdən günahları yox etmək və sizi tam pak etmək istəyir} sözlərindəki əhli-beytə Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri daxil deyillər. Halbuki bu ayə onların da bu hökmə daxil olduğunu göstərir."[685] Böyük şafii fəqihi Əbu İshaq əş-Şirazi (h. 476) bu ayə ilə bağlı deyir ki, "əhli-beytə kişinin evindəki bütün zövcələri daxildir."[686] Hənbəli alimi Əbul-Xattab əl-

---

[677] "əl-Muxallisiyyət", 3/348-349 (2686)
[678] İbn Kəsir, "Təfsir İbn Kəsir", 11/153 (Əvladuş-Şeyx)
[679] əz-Zəhəbi, "Siyər Aləmin-Nubələ", 2/221
[680] əş-Şəvkəni, "Fəthul-Qadir", 4/321;
[681] "Təfsir əl-İmam əş-Şafi", 3/1193;
[682] əl-Cəssas, "Əhkəmul-Quran", 3/214;
[683] əd-Dəni, "əl-Muktəfə fil-Vaqf val-İbtidə", səh: 167;
[684] əl-Mursi, "əl-Muhkəm val-Muhit əl-Azam", 4/355;
[685] əs-Səmani, "Təfsir əs-Səmani", 2/444;
[686] əş-Şirazi, "ət-Təbsira fi Usul əl-Fiqh", səh: 369;

Kəlvazəni (h. 510) yazır ki, “ayədəki murad qadınlardır.”[687] Digər hənbəli alimi Əbul-Vafə İbn Aqil (h. 513) deyir ki, “ayədəki xitab Peyğəmbərin zövcələrinə aiddir.”[688] Məşhur təfsir alimi Əbu Muhəmməd əl-Bəğavi (h. 510) deyir: “Burada Əhli-Beyt ilə Peyğəmbərin - salləllahu aleyhi va sələm - zövcələri nəzərdə tutulmuşdur, çünki onlar onun evindədirlər. Bu, Səid ibn Cübeyrin İbn Abbasdan rəvayətidir. O, bu ayəni tilavət etmişdir: 'Evlərinizdə oxunan Allahın ayələrini və hikməti yadınıza salın.' Bu, İkrimə və Müqatilin də görüşüdür.”[689] Əbul-Qasim əl-Kirməni (h. 531) təfsirində yazır ki, “təhqiq əhli bu ayənin onların beşi (Peyğəmbərin - salləllahu aleyhi va səlləm - özü, Əli, Fatimə, Həsən və Hüseyn) və həmçinin Peyğəmbərin - salləllahu aleyhi va səlləm - bütün zövcələri haqqında nazil olması qənaətindədirlər. Bunun dəlili ayənin əvvəlində və sonrasında gələn digər ayələrdir. Həmçinin bir kişinin zövcəsi onun Əhli-Beytindən sayılır.”[690] Mötəzili üləmasından məşhur təfsir alimi əz-Zəməxşəri (h. 538) yazır ki, “burada Peyğəmbərin - salləllahu aleyhi va səlləm - xanımlarının da onun əhli-beytindən olmasına dair aşkar bir dəlil vardır.”[691] Əndəlüslü təfsir alimi İbn Atiyyə (h. 542) deyir: “Mənə aydın olan budur ki, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri heç bir halda bu ayənin dəlalətindən kənara çıxmırlar, çünki Əhli-Beyt onun zövcələri, qızı, onun övladları və onun kürəkənidir. Bu ayə açıq şəkildə göstərir ki, zövcələr Əhli-Beytdəndirlər, çünki ayə onlar haqqında nazil olmuş və müraciət də onlara yönəlmişdir.”[692] Nəşvan bin Said əl-Himyəri (h. 573) deyir ki, bununla Peyğəmbərin - salləllahu aleyhi va səlləm - xanımlarını qəsd edir.”[693] Fəxruddin ər-Razi (h. 606) də eyni şəkildə ayənin əsasən Peyğəmbərin zövcələrinə aid olduğunu təsdiqləyir və deyir: “Ayənin zahiri mənası Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqındadır, çünki ondan əvvəl və sonra gələn ifadələr onlara müraciət edir. Allah-Təala buyurmuşdur: 'Evlərinizdə qərar tutun və ilk cahiliyyə dövründə olduğu kimi açıq-saçıq

---

[687] əl-Kəlvazəni, “ət-Təmhid fi Usul əl-Fiqh”, 3/278;
[688] İbn Aqil, “əl-Vadih fi Usul əl-Fiqh”, 5/190;
[689] əl-Bəğavi, “Təfsir əl-Bəğavi”, 6/350;
[690] əl-Kirməni, “Lubəb ət-Təfəsir”, səh: 2184
[691] əz-Zəməxşəri, “Təfsir əl-Kəşşəf”, 3/538
[692] İbn Atiyyə, “əl-Muhərrar əl-Vaciz”, 4/384;
[693] əl-Himyəri, “Şəmsul-Ulum”, 7/4172

gəzməyin.' Bu, bir insanın oğluna belə deməsi kimidir: 'Öyrən və mənə itaət et, çünki mən sənin üçün yalnız yaxşılıq istəyirəm.' Məlumdur ki, bu söz yalnız onun oğlunu əhatə edir. Burada da eyni məntiq tətbiq edilir…Müraciətdə kişi cəm formasının işlədilməsi zövcələrin nəzərdə tutulmasına mane olmur. Bu, sadəcə olaraq, müraciətin yalnız onlara məhdudlaşdırılmasını qeyri-mümkün edir."[694] Seyfuddin əl-Əmidi (h. 631) yazır: "Ayə əslində Peyğəmbərin - salləllahu aleyhi va sələm - zövcələri haqqında nazil olmuşdur. Çünki məqsəd, onlara qarşı yönələ biləcək ittihamları aradan qaldırmaq və insanların onlara nəzər salmasının qarşısını almaq idi. Bunu ayənin əvvəlində və sonunda gələn ifadələr də təsdiqləyir. Allah-Təala buyurmuşdur: "Ey Peyğəmbərin zövcələri! Siz hər hansı bir qadın kimi deyilsiniz. Əgər (Allahdan) qorxursunuzsa, (yad kişilərlə) nazlana-nazlana danışmayın, yoxsa qəlbində xəstəlik olan tamaha düşər. (Şəriətə) müvafiq qaydada danışın." Sonra deyir: "Evlərinizdə qərar tutun! İlk cahiliyyə dövründə olduğu kimi açıq-saçıq gəzməyin. Namaz qılın, zəkat verin, Allaha və Onun Elçisinə itaət edin. Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir." Peyğəmbərin - salləllahu aleyhi va sələm - "Bunlar mənim Əhli-Beytimdir" deməsi, onun zövcələrinin də Əhli-Beytdən olmasına zidd deyil və onlara xitab edən ayət buna dəlalət edir. Həmçinin Ummu Sələmədən nəql edilən bu hədis də bunu təsdiqləyir. O, Peyğəmbərə - salləllahu aleyhi va sələm - dedi: 'Mən də Əhli-Beytdən deyiləmmi?' O dedi: 'Bəli, inşallah.' Əgər biri belə desə: 'Əgər "Ey Əhli-Beyt! Allah sizdən günahları yox etmək və sizi pak etmək istəyir" ayəsi zövcələrə aid olsaydı o zaman "عنكن" (sizdən - qadın cəm) deyərdi.' Biz deyərik ki, ayənin əvvəlində zövcələrə müraciət edilsə də, onlara "Əhli-Beyt" deyildikdən sonra onların içərisinə kişi cinsindən olanlar da daxil edilmişdir. Beləcə, Əli, Həsən və Hüseyn də bu müraciətə daxil olduğu üçün kişi cəm forması istifadə edilmişdir. Çünki bir cəm halında həm kişilər, həm də qadınlar olduqda, qaydaya görə kişi cəm forması üstün tutulur. Bu, Allah-Təalanın İbrahim Peyğəmbərin zövcəsi haqqında buyurduğu ayədə də müşahidə olunur: 'Biz onu İshaqla, (İshaqın) ardınca da Yaqubla müjdələdik. O dedi: "Vay halıma! Mən bir qoca qarı, bu ərim də bir qoca kişi olduğu halda doğa bilərəmmi? Doğrusu, bu, təəccüblü bir şeydir". Onlar dedilər: "Allahın əmrinə təəccübmü edirsən? Ey ev əhli! Allahın rəhməti və bərəkəti sizin

[694] ər-Razi, "əl-Məhsul", 4/171-173;

üstünüzdə olsun!' Burada "Əhli-Beyt" ifadəsi İbrahimin zövcəsinə və onun evində olan digər kişilərə və qadınlara aiddir."[695] Əbu Abdilləh əl-Qurtubi də buyurur: "Ayədən açıq şəkildə görünən budur ki, o, Əhli-Beytin bütün üzvlərinə – həm zövcələrə, həm də başqalarına – şamil edilir. Allah-Təala 'və sizi pak etsin' ifadəsini kişi cəm formasında işlətmişdir, çünki Peyğəmbər - salləllahu aleyhi va səlləm -, Əli, Həsən və Hüseyn də onların arasında idi. Qaydaya görə, kişi və qadın birlikdə olduqda kişi cəm forması üstün tutulur. Bu ayə göstərir ki, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri də Əhli-Beytdəndirlər. Çünki ayə onların barəsində nazil olmuşdur və müraciət onlara ünvanlanmışdır. Bunu ayənin ümumi konteksti açıq şəkildə təsdiqləyir."[696] İbnul-Əhnəf əl-Yəməni (h. 717) yazır ki, ayədəki "əhli-beyt xüsusilə Peyğəmbərin - salləllahu aleyhi va səlləm - xanımlarıdır, çünki onun evində yaşayırlar. Ayədə xitabın kişi cinsində "عنكم" olaraq gəlməsi isə yalnız ona görədir ki, çünki Allahın elçisi - salləllahu aleyhi va səlləm - onların arasındadır, beləliklə də kişi cinsi ilə qadın cinsi bir araya gələrsə kişi cinsinə üstünlük verilər."[697] Mütəkəllim hənəfi alimi Aləuddin əl-Buxari (h. 730) deyir: "Allah-Təalanın {Ey ev əhli! Allah sizdən günahınızı silib aparmaq və sizi tərtəmiz etmək istəyir.} buyruğunda nəzərdə tutulanlar, təfsir alimlərinin əksəriyyətinə görə, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələridir."[698] Əbu Həyyan əl-Əndəlüsi (h. 745) deyir: "Və namaz qılın" – Allah-Təala onları namaz və zəkatı yerinə yetirməyə xüsusi şəkildə əmr etdi. Çünki bu ikisi bədən və mal ilə edilən itaətin əsas sütunlarıdır. Daha sonra isə bu iki əmri ümumi itaət əmri daxilində gətirdi. Sonra isə aydınlaşdırdı ki, Onun onlara verdiyi qadağalar, əmr və nəsihətlər onların günahlardan uzaqlaşdırılması və təqva ilə qorunmaları üçündür. Əhli-Beyt ifadəsi həm onları (zövcələri), həm də atalarını əhatə etdiyinə görə, müraciətdə kişi cəm forması üstün tutuldu. Buna görə də 'عنكم' və 'يطهركم' ifadələri kişi cəm formasında gətirildi. Açıq şəkildə görünür ki, burada nəzərdə tutulanlar Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri və ailəsidir. Beləliklə, zövcələr Əhli-Beytdən xaric edilmir, əksinə, onlar bu ada daha layiqdirlər, çünki onlar Peyğəmbərin -

[695] əl-Əmidi, "əl-İhkəm fi Usul əl-Əhkəm", 1/247;
[696] əl-Qurtubi, "əl-Cami li Əhkəm əl-Quran", 14/183
[697] əl-Yəməni, "əl-Bustən fi İrab Muşkilət əl-Quran", 2/119;
[698] əl-Buxari, "Kəşful-Əsrar", 3/242;

salləllahu aleyhi va səlləm - evində daimi olaraq yaşayırdılar."[699] Şəmsuddin Əbus-Sənə əl-Əsfəhəni (h. 749) yazır ki, "ayədəki əhli-beyt ilə qəsd olunan Allahın elçisinin - salləllahu aleyhi va səlləm - zövcələridir."[700] İbnul-Qayyim əl-Cəvziyyə (h. 751) bu ayəni qeyd etdikdən sonra buyurur: "Onlar (yəni Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri) Əhli-Beytə daxildirlər, çünki bu müraciətin bütün konteksti onların (zövcələrin) zikri üzərində qurulmuşdur. Buna görə də onları bu ifadədən istisna etmək caiz deyildir."[701] İbn Kəsir (h. 774) deyir: "Bu, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələrinin burada Əhli-Beytə daxil olduğuna dair açıq bir nasdır. Çünki bu ayənin nazil olmasına səbəb onlar olmuşdur və nazilolma səbəbi ixtilafsız olaraq hökmün içindədir – istər yalnız onlar üçün olsun (bəzi görüşlərə görə), istərsə də digərləri ilə birlikdə (ən doğru görüşə görə). İkrimə demişdir: 'Kim istəsə, onunla mübahilə edərəm ki, bu ayə Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri haqqında nazil olmuşdur.' Əgər bunun mənası onların nazilolma səbəbi olduğu və digərlərinin buna daxil olmadığıdırsa, bu, doğrudur. Lakin əgər məqsəd onların təkcə onlara aid olması və başqalarının bu məfhuma daxil edilməməsidirsə, bu mübahisəlidir. Çünki bu ayənin məzmununun daha geniş olduğunu göstərən hədislər mövcuddur."[702] Bədruddin əz-Zərkəşi (h. 794) yazır: "(Şiələrin gətirdikləri) sübutlarından biri də Peyğəmbərin - salləllahu aleyhi va səlləm - 'Kisə əhli' haqqında dediyi bu sözlərdir: 'Bunlar mənim Əhli-Beytimdir. Allahım! Onlardan günahları uzaqlaşdır və onları tam pak et!' Lakin Quranın məzmunu göstərir ki, burada əsasən Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələri nəzərdə tutulmuşdur və ayə onların barəsində nazil olmuşdur. Buna görə də, onların bu ayədən xaric edilməsi mümkün deyil. Bununla yanaşı, başqalarının da bu ayəyə daxil edilməsi istəndiyi üçün kişi cəm formasında belə buyurulmuşdur: 'Həqiqətən, Allah yalnız sizdən, ey Əhli-Beyt, çirkinliyi yox etmək və sizi tam pak etmək istəyir.' Bu da göstərir ki, burada nəzərdə tutulan istək bütün Əhli-Beyti - həm kişiləri, həm də qadınları əhatə edir. Lakin bu, 'Ey Peyğəmbərin zövcələri!' ifadəsi ilə edilən xüsusi müraciətdən fərqlidir. Bundan da belə anlaşılır

[699] İbn Həyyan, "əl-Bəhr əl-Muhit", 8/479;
[700] əl-Əsfəhəni, "Bəyan əl-Muxtəsar", 1/571;
[701] İbnul-Qayyim, "Cəlaul-Əfhəm", səh: 220;
[702] İbn Kəsir, "Təfsir İbn Kəsir", 11/152;

ki, Əli və Fatimə - aleyhimassələm - bu sifətə (Əhli-Beytə aid olmağa) zövcələrdən daha çox layiqdirlər."[703] Əbu Bəkr əl-Həddəd əl-Yəməni (h. 800) təfsirində ayənin zövcələr haqqında nazil olduğunu təsdiqləyir.[704] Cələluddin əd-Dəvvani (h. 918) deyir: "Bu ayənin nazil olma səbəbi Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələridir və ayə onlar haqqında nazil olmuşdur. Bunu ayənin əvvəlində və sonunda gələn ifadələr də sübut edir. Buna əsasən, Əhli-Beyt məhz zövcələrdir və Allah-Təalanın onlardan çirkinliyi uzaqlaşdırmaq istəməsi də onlara aiddir. Eləcə də, burada nəzərdə tutulan paklanma onlar üçündür. Lakin Əli, Fatimə, Həsən və Hüseyn - radiyallahu anhum - də Əhli-Beytdən idilər, lakin onlar bu ayənin ifadə tərzinə yalnız kişi cəm əvəzliklərinin ('عنكم' və 'يطهركم') üstün tutulması yolu ilə daxil olmuşdular. Buna görə də Peyğəmbər - salləllahu aleyhi va səlləm - onları 'Kisa' hədisində açıq şəkildə bu məfhumun içində olduğunu izah etmək üçün xüsusi olaraq qeyd etmişdir. Beləliklə, onların (Əli, Fatimə, Həsən və Hüseynin) bu ayəyə daxil olmasının dəlili hədis, zövcələrin isə Qurandır… Bir insanın zövcələrinin onun Əhli-Beyti sayıldığını sübut edən ən güclü dəlillərdən biri də Allah-Təalanın İbrahim peyğəmbərin zövcəsi Sara haqqında buyurduğu bu ayədir: 'Sən Allahın əmrinə təəccüb edirsən? Allahın rəhməti və bərəkətləri sizin üzərinizə olsun, ey Əhli-Beyt!'."[705] Hənbəli təfsir alimi Muciruddin əl-Uleymi (h. 927) də yazır ki, ayədəki "murad, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcələridir."[706]

Şiələr əhlüs-sünnətə etiraz edərək deyirlər ki, ayədə əhli-beytə xitab ərəb dilində kişi cinsində varid olub. Bununla bağlı əhlüs-sünnət alimlərinin ayədə əhlul-beytə xitabın kişi cinsində gəlməsi barəsində birdən çox izahı mövcuddur. Biz bunların içində əsas olan iki izahı təqdim edəcəyik:

Birinci: əl-Həkim ət-Tirmizi rafiziləri qəsd edərək deyir: "Bunlar ifratlarında o həddə çatdılar ki, Əli - radiyallahu anhu - üçün fəzilət bəyan etmək məqsədilə uydurulmuş hədislər nəql etdilər. Halbuki Allah Əliyə - radiyallahu anhu - çoxsaylı fəzilətlər və üstünlüklər bəxş etmişdir

---

[703] əz-Zərkəşi, "əl-Burhan fi Ulum əl-Quran", 2/197;

[704] əl-Həddəd, "Kəşf ət-Tənzil", 5/194;

[705] əd-Dəvvani, "əl-Hucəc əl-Bəhira", səh: 219;

[706] əl-Uleymi, "Fəthur-Rahmən", 5/363;

sayılırlar.[770] Gördüyümüz kimi bu ləfzdə varid olmuş rəvayətlər əhlüs-sünnətin mötəbər kitablarında keçmir, qarşılaşdığımız tək bir misalın isə yalan danışmaqda ittiham olunmuş aşırı rafizi tərəfindən rəvayət edildiyini gördük. Şiələrin öz kitablarında belə bu xəbərin səhih bir isnadı yoxdur.

Daha bir rəvayət Peyğəmbərin - sallallahu aleyhi va səlləm - ömrünün sonunda vəfat etmədən əvvəl öz elmi mirasını Əliyə təhvil etməsi mənasında gəlmiş bir xəbərdir. əl-Kuleyni "əl-Kəfi" kitabında isnadı ilə İmam Muhəmməd əl-Baqir'in belə dediyini rəvayət edir: "Muhəmməd – sallallahu aleyhi və alih – peyğəmbərliyini başa vurduqda və ömrünü tamamladıqda, Allah Təala ona vəhy etdi: 'Ey Muhəmməd, artıq sən peyğəmbərliyini başa çatdırdın və günlərini tamamladın. Elə isə yanında olan elmi, imanı, İsm-i Əzəmi, elmin mirasını və peyğəmbərlik elminin nişanələrini öz Əhli-beytindən olan Əli ibn Əbi Talibə təhvil ver. Çünki Mən, necə ki, bu şeyləri əvvəlki peyğəmbərlərin nəsillərindən kəsmədimsə, eləcə də sənin nəsilindən – zürriyyətindən – kəsməyəcəyəm.'"[771] İsnadında Muhəmməd bin əl-Fudeyl keçməkdədir. Əgər o, əl-Əzdi'dirsə haqqında Əbul-Qasim əl-Xoyi yazır ki, "aşırılıqda (ğuluv) ittiham olunur, onun bir kitabı var. ət-Tusi onu ər-Rida'nın - aleyhissələm - əshabında hesab edir. Bəzən də əs-Sadiq'in - aleyhissələm - əshabından olduğunu deyərək buyurur: "Muhəmməd ibn əl-Fudeyl bin Kəsir əl-Əzdi əl-Kufi əs-Sayrafi". Başqa yerdə əl-Kazım'ın - aleyhissələm - əshabından sayaraq deyir: "Muhəmməd bin əl-Fudeyl əl-Kufi əl-Əzdi, zəifdir…"[772] Əgər əl-Əzdi deyilsə o zaman məchuldur; Muhəmməd əl-Cəvahiri yazır ki, "Muhəmməd bin əl-Fudeyl məchuldur, ən-Nəcəşi onun haqqında bir şey yazmır, eləcədə əş-Şeyx ricəl kitabında çap olunmuş nüsxədən başqalarında onun barəsində danışmır."[773] Üstəlik bu rəvayət isnad baxımından səhih olsaydı belə hüccət olmazdı, çünki mətn olaraq şiələrin öz rəvayət etdiklərinə müxalifdir. Beləki şiələr iddia edirlər ki,

---

[770] Əhlüs-sünnətin ricəl elmi ilə hökm verməli olsaydı isnadındakı Əbu Həmzə əs-Suməli zəifdir. Zureyh əl-Muharibi haqqında isə ümumiyyətlə məlumat yoxdur, məchuldur. Abdullah bin Cəbələ bin Həyyan da məchuldur. Ondan bunu rəvayət edən Əli bin əl-Həsən bin Fəddal da məchuldur, şiələrin öz verdikləri məlumatlara əsasən Quranın təhrifi haqqında bir kitab yazıb.

[771] əl-Kuleyni, "əl-Kəfi", 1/293; əl-Məclisi "Mirətul-Uqul" kitabında (3/269) deyir ki, rəvayət məchuldur.

[772] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 18/151 (11591);

[773] əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 567;

Allahın elçisi - aleyhissalətu vassələm - Əlini özünə vasi və varis olaraq xeyli əvvəl seçmişdi.

Şiələrin Əlinin imamətinə dair əhlüs-sünnət kitablarından gətirdikləri daha bir rəvayət məşhur Tayr (Tair) rəvayətidir. ət-Tirmizi və başqalarının rəvayət etdiklərinə əsasən Ənəs bin Malik - radiyallahu anhu - deyib: “Peyğəmbərdə - salləllahu aleyhi va səlləm - (yemək üçün) bir quş var idi. Dedi: “Allahım yaratdıqların arasında Sənə ən sevimli olan kəsi mənimlə bu quşu yemək üçün göndər!” Beləliklə, Əli gəldi və onunla birlikdə yedi.”[774] ən-Nəsai bu hədisi bir qədər daha geniş şəkildə rəvayət edir və deyir ki, Ənəs bin Malik deyib: “Peyğəmbərdə – sallallahu aleyhi və alih – (yemək üçün) bir quş var idi. O dedi: "Allahım! Yaratdıqların arasında sənə ən sevimli olan kəsi mənimlə bu quşdan yemək üçün göndər!" Sonra Əbu Bəkr gəldi, amma onu geri çevirdi. Sonra Ömər gəldi, onu da geri çevirdi. Sonra Əli gəldi və ona icazə verdi.”[775] Tayr hədisi bu şəkildə içində qəribəliklər olan bir xəbərdir. Əgər Allah - cəllə cəlaluhu - birini Əbu Bəkri göndəribsə deməli ən sevimli qulu o olmalıydı; yox əgər seçimlə olan bir şeydirsə o zaman Allahın elçisinin - salləllahu aleyhi va səlləm - bu cür dua etməyinin mənası qalmır, birbaşa Əli bin Əbi Talibin özünü qonaq çağırması kifayət edərdi. Ənəsdən gələn sənədlərin çoxunu yalançı və məchul ravilər təşkil edir və Ənəs bin Malik’in məşhur tələbələrinin heç birindən səhih sənədlə sabit olmayıb. Əbu Yalə əl-Xalili yazır: “Tayr hədisini heç bir siqa ravi rəvayət etməyib, onu İsmail bin Səlman əl-Əzraq və ona bənzər zəiflər rəvayət ediblər və bunu hədis imamlarının hamısı rədd edir.”[776] Əbu Bəkr əl-Bəqilləni bu hədisin sənəd və mətn baxımından zəif olduğunu göstərmək üçün böyük bir kitab yazıb.[777] Əbu Cəfər əl-Uqeyli deyir: “Bu mövzudakı rəvayətdə lin[778] və zəiflik var; bu barədə sabit olmuş heç bir şey bilmirik. Muhəmməd bin İsmail əl-Buxari bu şəkildə deyib.”[779] Hafiz İbn Tahir əl-Qeysərani deyir: “Tair

---

[774] “Sunən ət-Tirmizi”, 6/293 (4055);

[775] ən-Nəsai, “Xasais Əli”, səh: 29 (10); “əs-Sunən əl-Kubra”, 7/410 (8341); Bunun da isnadı zəifdir, çünki isnadındakı Mushir bin Abdulməlik zəif ravidir. Bunu yenə də əs-Suddi rəvayət edir; bəzi alimlərimiz onu təvsiq etsələr də İbn Main, Abdurrahmən bin Mehdi, Əbu Zura ər-Razi, əl-Uqeyli kimi alimlər onu cərh ediblər, zəif olduğunu deyiblər. əs-Suddi rafiziliyində aşırı olmaqla tanınır, Əbu Bəkrə və Ömərə dil uzadardı.

[776] əl-Xalili, “əl-İrşad fi Mərifəti Ulımə əl-Hədis”, 1/319;

[777] İbn Kəsir, “əl-Bidəyə van-Nihəyə”, 11/83;

[778] Lin yumşaqlıq, gevşəklik deməkdir. Ravinin qeyri-ciddiliyinə işarə etmək üçün deyilir.

[779] əl-Uqeyli, “əd-Duafə əl-Kəbir”, 1/46 (33);

hədisi uydurmadır; o yalnız Kufə əhlinin saqit (yəni etibardan düşmüş) ravilərinin məşhur və məchul ravilər vasitəsi ilə Ənəsdən və başqalarından rəvayəti ilə gəlir."[780] Maraqlıdır ki, Ənəs bin Malik şiələrin nəzərində yalançı olub. Hətta bu barədə İmam Cəfər əs-Sadiq'dən və atasından xəbərlər rəvayət ediblər. Şeyx əs-Saduq'un İmam Cəfərə nisbət etdiyi bir xəbərdə o deyir: "Üç nəfər Allahın elçisinin adından yalan danışırdılar; Əbu Hureyra, Ənəs bin Malik və bir qadın."[781] Qadın ilə qəsd etdikləri Aişə anamızdır.[782] Yenə əs-Saduq "İləl əş-Şərai" kitabında belə bir xəbər rəvayət edir ki, guya İmam Muhəmməd əl-Baqir deyib: "Hökmdarların işgəncəni halal saymalarına səbəb olan ilk şey, Ənəs ibn Malikin Allahın elçisinin - salləllahu aleyhi və alih - adından söylədiyi bu yalan oldu ki, Peyğəmbər bir kişinin əlini divara mismarlayıb Beləcə, hökmdarlar işgəncəni halal saymağa başladılar."[783] Şiə alimi Əli əl-Kurani əl-Amili yazır ki, "İmam Muhəmməd əl-Baqir - aleyhissələm - ortaya qoydu ki, Ənəs bin Malik Allahın elçisinin - salləllahu aleyhi va əlihi - adından yalan danışıb və bunu insan haqlarını pozmaqda və müxalif olan müsəlmanlara əzab verməkdə hakimlərə bəraət qazandırmaq üçün edib."[784] Belə çıxır ki, Ənəs bir Malik siyasi məqsədlər üçün, şəxsi mənfəətlər üçün Allahın elçisinin - salləllahu aleyhi va səlləm - adından yalan danışmaqda ittiham olunur. Maraqlıdır ki, şiə alimi Abdulhuseyn Şərəfuddin əl-Musəvi "əl-Muracəat" kitabında bu gözəl səhabəyə qarşı kin qusarkən belə bir şey deyir: "Neçə-neçə insanlar oldu ki, ədavət onları şahidlik borcunu yerinə yetirməkdən oturub saxladı; Ənəs ibn Malik və başqaları kimi. Beləliklə, onlar möminlərin əmirinin - aleyhissəlam - duasına tuş gəldilər." Sonra əl-Musəvi bunun təfsilatı haqqında qeyd açaraq yazır: "Belə ki, Əli - aleyhissəlam - ona dedi: "Nə üçün Allahın Rəsulunun səhabələri ilə birgə durub o gün Ondan eşitdiyin şeyə (yəni Ğadir Xum hadisəsinə) şahidlik etmirsən?" O isə cavab verdi: "Ey möminlərin əmiri! Yaşım artdı və unutdum." Əli - aleyhissəlam - buyurdu: "Əgər yalan deyirsənsə, Allah səni elə bir ağartıya düçar etsin ki, onu əmmamə də gizlədə bilməsin." (Ənəs) ayağa qalxmadı, ta ki üzü albinizm ilə ağardı və o, bundan sonra deyərdi: "Başıma gələnlər, saleh qulun duasıdır." Sitatın sonu. Deyirəm: Bu, məşhur bir fəzilət

---

780 İbnul-Cəvzi, "əl-İləl əl-Mutənəhiyə", 1/234.

781 əs-Saduq, "əl-Xisal", səh: 190;

782 Bax: əl-Məclisi, "Bihərul-Ənvar", 2/217;

783 əs-Saduq, "İləl əş-Şərai", 2/541

784 əl-Kurani, "Əlf Suəl va İşkəl", 2/449;

hadisəsidir və onu imam İbn Quteybə əd-Dinəvari də qeyd etmişdir; beləki o, "əl-Məarif" adlı kitabında Ənəsi eyb sahibləri sırasında zikr etmişdir. Bu hadisəyə İmam Əhməd ibn Hənbəlin "əl-Musnəd" kitabında gələn rəvayət də şahidlik edir. Orada deyilir: "(Səhabələrdən) üç nəfər istisna olmaqla hamısı qalxdılar və Əli - aleyhissəlam - onlara dua etdi və bu duası onlara isabət etdi."[785] Sözün düzü əl-Musəvi'nin oxucusuna təqdim etdiyi bu yalanın harasından başlayacağımızı bilmirik. Əgər bu hadisə məşhur bir fəzilət hadisəsidirsə necə olur ki, bunu İbn Quteybə'dən başqa heç kim qeyd etmir? Üstəlik əl-Musəvi nə üçün qeyd etmir ki, İbn Quteybə bu xəbəri heç bir isnad zikr etmədən gətirdikdən sonra: "bunun heç bir əsli yoxdur"[786] deyir. əl-Musəvi elə bir təəssürat qurmaq istəyir ki, sanki İbn Quteybə kimi hədis əhlinin böyük imamlarından biri bu xəbəri təsdiqləyib. Amma həqiqət bunun tam əksini deyir. İmam Əhməd'in "əl-Musnəd" kitabında rəvayət etdiyinə gəldikdə isə isnadında əl-Valid bin Uqbə bin Nizər əl-Qeysi və Simək bin Ubeyd bin əl-Valid əl-Absi adlı iki məchul ravi var. Onu da əlavə edək ki, əl-Musəvi çox gözəl bilir ki, əl-Musnəd'dəki rəvayətdə Ənəs bin Malik'in adı əslən çəkilmir. Bu cür saxta və əsassız xəbərlərə əsaslanaraq Allah elçisinin - aleyhissalətu vassələm - xidmətçisinə[787] ağır ittihamlar yapışdırmağa çalışmaq insaf sahibinə yaraşan bir əməl deyildir. Şiə kitabları Ənəs bin Malik'ə qarşı yönəldilmiş əsassız və saxta ittihamlarla doludur. Ümumiyyətlə Ənəs şiə alimlərinə görə yalançı və etibarsız bir kimsə olub. Zeynuddin Əbu Muhəmməd Əli bin Muhəmməd əl-Bəyadi əl-Anfəcuri əl-Nəbəti əl-Amili (h. 791-877) buyurur: "Ənəs, Əlidən - aleyhissəlam - üz döndərməsi ilə məşhurdur. O, Əlinin fəzilətini gizlətmiş və Tair (quş) hadisəsində onu (qapıdan) geri çevirmişdir. Bundan daha kiçik bir şeyə görə rəvayətində ittiham olunar və ədaləti düşürür."[788] Bütün bunlardan sonra belə bir sual verməyimiz lazımdır: Əgər Ənəs bin Malik yalançıdırsa o zaman onun Tair hadisəsi barəsində rəvayət etdikləri necə etibar qazanır?! Yoxsa Ənəsin - yalançı olmağına (haşa!) baxmayaraq - şiə məzhəbinin xeyrinə rəvayət etdikləri şiələrin nəzdində məqbul, onların əleyhinə rəvayət etdikləri isə mərduddur?! Rəvayətləri süzgəcdən keçirmək üçün nə

---

785 əl-Musəvi, "əl-Muracəat", səh: 195-196; Muəssəsətul-Vafə çapı. 1402-ci il Beyrut çapında səh 268-269;

786 İbn Quteybə, "əl-Məarif", 1/580; Qahirə, 1992

787 Hətta Peyğəmbərin - aleyhissalətu vassələm - xidmətçisi kimi tanınmış Ənəsin əslində Ənəs bin Malik deyil, başqa bir Ənəs olduğunu deyirlər. Bax: Nəcəh ət-Tai, "Nəzariyyətul-Xalifəteyn", 2/192;

788 ən-Nəbəti, "əs-Sirat əl-Mustəqim ilə Mustəhiqqi ət-Təqdim", 2/144;

qədər də elmi və səmərəli bir metoddur bu! Bunun aşkar bir ziddiyyət olduğu ağıl və insaf sahiblərinə gizli deyildir. Onu da əlavə edək ki, Tair hədisi səhih olsa belə orada Əlinin imamətinə dair dəlil yoxdur, ən yaxşı halda onun səhabələr içində ən fəzilətli olmasına dəlil olacaq. Lakin hədis səhih deyildir.

Şiələrin gətirdikləri bir başqa dəlil isə budur ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əbu Bəkri həcc qafiləsinə əmir təyin etdiyi halda daha sonra onun əmirliyini geri almış və Əlini təyin etmişdir. Məkkəyə doğru yürüyən həcc qafiləsinə verilmiş tapşırıqlardan biri də Bəraət surəsinin müşriklərə çatdırılması və onları həcc etməkdən qadağan etmək idi. Bu məzmunda gəlmiş xəbərlərin ləfzində Allahın elçisinin - salləllahu aleyhi va səlləm - Bəraət surəsinin təbliği ilə bağlı belə dediyi keçməkdədir: “Bunu məndən yalnız əhlul-beytimdən biri çatdıra bilər.”[789] Bu sözü əsas gətirən şiə alimləri deyirlər ki, burada təbliğ Bəraət surəti ilə məhdud deyildir, ona xas deyildir; Allahdan gələn hər bir xəbəri təbliğ etməkdə Əli Peyğəmbərimizə - aleyhissalətu vassələm - şərikdir. ət-Tabətabəi deyir: “Necə olursa olsun, bu, mütləq bir ifadədir və Peyğəmbərin - salləllahu aleyhi və alih - öz yerinə başqasının çatdırmasına ehtiyac duyduğu istənilən ilahi hökmün təbliğini əhatə edir və nə rəvayətlərin mətnlərindən, nə də başqa bir yoldan bu məsələnin yalnız Bəraət surəsi ilə məhdud olduğuna dair bir dəlil yoxdur.”[790] Muhəmməd Baqir əl-Məclisi yazır: “əs-Siratu'l-Mustəqim" kitabının müəllifi möminlərin əmirinin - aleyhissalam - fəzilətlərini sadalarkən belə demişdir: Bunlardan biri, Peyğəmbərin - salləllahu aleyhi və alih - əvvəlcə Əbu Bəkrə tapşırdığı Bəraət surəsinin çatdırılmasını ona həvalə etməsi, sonra isə onu Cuhfədə yaxalayıb surəni ondan alaraq, Həcc mövsümündə özü təbliğ etməsidir. Bunu Əhməd ibn Hənbəl öz "Müsnəd"ində bir neçə yerdə qeyd etmişdir; əs-Sə’ləbi təfsirində, ət-Tirmizi "Səhih"ində, Əbu Davud "əs-Sünən"də, Muqatil təfsirində, əl-Fərra "əl-Məsabih" kitabında, İbn Cəvzi təfsirində, əz-Zəmaxşəri "əl-Kəşşaf" təfsirində qeyd etmişdir. əl-Buxari isə "əs-Səhih" kitabının birinci cildində "örtünmənin vacibliyi" babında, beşinci cildində isə "Allah və Rəsulunun elan etdiyi əhd" babında bunu qeyd etmişdir. Həmçinin bunu ət-Təbəri, əl-Bəlazuri, əl-Vaqidi, əş-Şə'bi, əs-Suddi, əl-Vahidi, əl-Qurtubi, əl-Quşeyri, əs-Səm'ani, əl-Musuli, İbn Bəttə, İbn İshaq, əl-A'məş və İbn Səmak öz kitablarında nəql etmişlər.”

---

[789] “Siratu İbn Hişam”, 2/545; “Musnəd Əhməd”, 1/183; “Sunən İbn Macə”, 119; “Sunən ət-Tirmizi”, 4053

[790] ət-Tabətabəi, “Təfsirul-Mizan”, 9/168;

Sitatın sonu. İbnul-Əsir "əl-Kamil" əsərində hicrətin doqquzuncu ili hadisələrini qeyd edərkən demişdir: Həmin ildə Əbu Bəkr insanlarla birlikdə həcc etdi. Onunla birlikdə Peyğəmbər - salləllahu aleyhi və alih - üçün iyirmi dəvə, özü üçün isə beş dəvə var idi və üç yüz nəfərlə idi. Zül-Huleyfədə ikən Peyğəmbər - salləllahu aleyhi və alih - onun ardınca Əlini - aleyhissalam - göndərdi və ona müşriklərə qarşı Bəraət surəsini oxumağı əmr etdi. Əbu Bəkr geri döndü və dedi: "Ya Rəsulallah, bu barədə bir vəhy endimi?" Buyurdu: "Xeyr, lakin mənim əvəzimdən ancaq mən özüm və ya məndən olan bir şəxs təbliğ edə bilər." – Sitatın sonu." "Camiu'l-Usul" müəllifi öz sənədi ilə Ənəsdən rəvayət edir: Peyğəmbər - salləllahu aleyhi və alih - Bəraət surəsini Əbu Bəkr ilə göndərdi. Sonra onu çağırdı və buyurdu: "Bu (suranı) mənim əvəzimdən yalnız Əhli-beytimdən bir adam təbliğ etməlidir." Beləcə Əlini - aleyhissalam - çağırdı və ona verdi. Sonra belə əlavə etdi: … "Çünki mənim əvəzimdən yalnız Əhli-beytimdən bir adam təbliğ etməlidir." Sonra ikisi razılaşıb yola çıxdılar. – Sitatın sonu." Bunları qeyd etdikdən sonra əl-Məclisi deyir: "Deyirəm: Sənə oxuduğum bu xüsusi və ümumi xəbərlərlə tam tanış olduqdan sonra bil ki, bizim əshabımız — Allah onlardan razı olsun — bu xəbərlərlə Mövlamız möminlərin əmirinin - aleyhissalam - xilafətinə və Əbu Bəkrin ona layiq olmadığına dəlil gətirmişlər. Onlar demişlər: Peyğəmbər - salləllahu aleyhi və alih - Əbu Bəkrə heç bir vəzifə verməmişdi, halbuki başqalarını vəzifəyə təyin edirdi. Və onu Məkkə əhlinə Bəraət surəsini çatdırmağa göndərdikdə onu əzl edib yerinə Əlini - aleyhissalam - göndərdi ki, surəni ondan alsın və insanlara oxusun. Belə isə, bir surənin bir şəhərə çatdırılması üçün belə münasib görülməyən kəs, bütün vilayətlərdə bütün camaata bütün hökmləri çatdırmaqdan ibarət olan ümumi rəhbərlik vəzifəsinə necə layiq ola bilərdi?!"[791] İbn Mutahhər əl-Hilli də bu arqumenti əl-Məclisi kimi belə çatdırır: "Həqiqətən, Peyğəmbər - salləllahu aleyhi və alih - onu (Əbu Bəkr) Bəraət surəsini çatdırmaq üçün göndərdi, sonra isə Əlini - aleyhissalam - göndərdi və ona (Əliyə) əmr etdi ki, onu (Əbu Bəkri) geri qaytarsın və bu işi özü yerinə yetirsin. Belə isə, bir surəni və ya onun bir hissəsini çatdırmağa belə münasib olmayan kəs, necə bütün ümmətə hökmlərin çatdırılmasını əhatə edən ümumi imamətə (rəhbərliyə) layiq ola bilər?!"[792]

---

[791] əl-Məclisi, "Bihərul-Ənvar", 35/308-310;

[792] əl-Hilli, "Minhəcul-Kəramə", səh: 181;

Şiələrin arqumentləri ilə tanış olduqdan sonra gəlin birlikdə həqiqətlərin necə təhrif edildiyinə şahid olaq. Hər şeydən əvvəl xatırlatmalıyıq ki, Allahın elçisi - salləllahu aleyhi va səlləm - Əlini - radiyallahu anhu - Bəraət surəsi ilə göndərdikdə Əbu Bəkri - radiyallahu anhu - geri qaytarmır, əksinə rəvayətlər onu göstərir ki, Əbu Bəkr və Əli hər ikisi də iştirak ediblər. ət-Tirmizi və ət-Tahavi'nin rəvayət etdiyinə əsasən İbn Abbas deyir: "Peyğəmbər - salləllahu aleyhi və səlləm - Əbu Bəkri göndərdi və ona bu sözləri (insanlara) çatdırmağı əmr etdi. Sonra isə onun ardınca Əlini göndərdi. Əbu Bəkr yolda olarkən, Peyğəmbərin - salləllahu aleyhi və səlləm - Qasva adlı dəvəsinin səsini eşitdi. Və qorxu içində çölə çıxdı; zənn etdi ki, Peyğəmbərdir. Lakin (gördü ki,) Əlidir. Beləcə, Peyğəmbərin - salləllahu aleyhi və səlləm - məktubunu ona verdi və Əliyə bu sözləri insanlara car çəkməsini əmr etmişdi. Beləcə, ikisi birlikdə hərəkət etdilər və həcc etdilər. Təşriq günlərində Əli ayağa qalxıb səsləndi: "Allahın və Onun Rəsulunun əhdi hər bir müşrikdən uzaqdır. Yerdə dörd ay sərbəst gəzin. Bu ildən sonra heç bir müşrik Həcc etməsin və heç bir çılpaq kəs evin (Kəbənin) ətrafında tavaf etməsin. Cənnətə yalnız mömin girəcəkdir." Əli bu sözləri səsləndirirdi, yorulduqda Əbu Bəkr ayağa qalxır və bu sözləri səsləndirirdi."[793] Hətta demək olar ki, bunu insanların arasında bəyan edib car çəkənlər təkcə Əli və Əbu Bəkr deyildir, başqaları da onlarla birlikdə insanlara Peyğəmbərin - salləllahu aleyhi va səlləm - məktubunu elan edirdilər. İmam əl-Buxari "əs-Sahih" kitabında rəvayət edir ki, Humeyd bin Abdirrahmən bin Auf bununla bağlı Əbu Hureyra'nın belə dediyini rəvayət edib: "Əbu Bəkr məni həmin həcc səfərində qurban günü Məkkənin Mina məntəqəsində elan edənlər arasında göndərdi ki, biz Minada azan verərək elan edək: "Bilin ki, bu ildən sonra heç bir müşrik Həcc etməyəcək və evin (Kəbənin) ətrafında çılpaq halda tavaf etməyəcək." Humeyd ibn Abdurrahman dedi: Sonra Allahın Rəsulu - salləllahu aleyhi və səlləm - Əlini arxasınca göndərdi və ona "Bəraət" surəsini çatdırmağı əmr etdi. Əbu Hüreyrə dedi: Beləliklə, Əli Minada qurban günü bizimlə birlikdə elan edirdi: "Bu ildən sonra heç bir müşrik Həcc etməyəcək və heç bir çılpaq adam evin (Kəbənin) ətrafında tavaf etməyəcək."[794] Əbu Hureyra'nın öz oğlu isə atasının belə dediyini

---

[793] "Sünən ət-Tirmizi", 3345; Şeyx Şueybin rəhbərliyi ilə edilmiş təhqiqdə muhəqqiq deyir ki, bu rəvayətin isnadı güclüdür. Bunu həmçinin ət-Təhavi "Şərh Muşkil əl-Əsər" kitabında (3585) rəvayət edir.

[794] "Sahih əl-Buxari", 362

rəvayət edir: “Allahın Rəsulu - salləllahu aleyhi və səlləm - Əli bin Əbi Talib’i "Bəraət" surəsi ilə Məkkə xalqına göndərdiyi zaman mən onunla birlikdə idim. (Oğlu) soruşdu: "Nə elan edirdiniz?" Dedi: "Elan edirdik ki, Cənnətə yalnız iman edən kəs daxil olacaq, Kəbənin ətrafında çılpaq halda tavaf edilməyəcək, və kimin Allahın Rəsulu - salləllahu aleyhi və səlləm - ilə arasında bir əhd varsa, onun müddəti dörd ayadəkdir. Dörd ay keçdikdə isə, artıq Allah da, Onun Rəsulu da müşriklərdən uzaqdır. Bu ildən sonra heç bir müşrik bu evi (Kəbəni) ziyarət etməyəcək." Dedi: "Mən səsim tutulana qədər elan etdim.”[795]
Bu rəvayətdən də anlaşılır ki, Əli ilə birlikdə elan etmək üçün müəyyən şəxslər təyin edən Əbu Bəkr olub. Bu isə bizi yuxarıda şiə alimlərinin sözündəki ikinci təhrifə , yəni Əbu Bəkrin öz vəzifəsindən azan edilməsi iddiasına gətirib çıxarır. Rəvayətdən də anlaşıldığı kimi Əbu Hureyra’nı təyin edən Əbu Bəkr idi və bunu etməsi yalnız əmir olduğu halda mümkündür. Ona görə də Əbu Bəkrin öz vəzifəsindən azad edilməsi iddiası həqiqətdən olduqca uzaqdır, Əbu Bəkr əksinə həcc qafiləsinin əmiri olaraq qalmışdı. Rəvayətlər bu nöqtəni çox açıq şəkildə bizə göstərir. İbn Hişam deyir: “İbn İshaq rəvayət edir: Hakim ibn Hakim ibn Abbad ibn Huneyfdən, o da Əbu Cəfər Muhəmməd ibn Əlidən - Allah ondan razı olsun - nəql edir ki, o dedi: "Bəraət surəsi Peyğəmbərə - salləllahu aleyhi və səlləm - nazil olduqda, o, insanlara həcc etdirmək üçün Əbu Bəkri göndərmişdi. Ona deyildi: 'Ya Rəsulullah, bunu Əbu Bəkrlə göndərsən olmazmı?' O buyurdu: 'Mənim adımdan bunu ancaq Əhli-Beytimdən bir nəfər yetirə bilər.' Sonra Əli ibn Əbu Talibi - Allah ondan razı olsun - çağırdı və ona dedi: 'Bu Bəraət surəsinin başlanğıc hissəsini götür və Minada insanlar bir araya gəldikdə, Qurban günü onlara elan et ki: Heç bir kafir cənnətə daxil olmayacaq. Bu ildən sonra heç bir müşrik həcc etməyəcək. Heç kim Kəbəni lüt şəkildə təvaf etməyəcək. Kimə Peyğəmbər - salləllahu aleyhi və səlləm - tərəfindən bağlanmış bir əhd varsa, onun müddəti başa çatanadək qüvvədədir.' Bundan sonra Əli ibn Əbu Talib - Allah ondan razı olsun - Peyğəmbərin - salləllahu aleyhi və səlləm - 'Əzba' adlı dəvəsinə minib yola düşdü və yolda Əbu Bəkrlə qarşılaşdı. Əbu Bəkr onu görüb soruşdu: 'Sən əmirsən, yoxsa əmrə tabe olan?' Əli - Allah ondan razı olsun - cavab verdi: 'Əmrə tabe olanam.' Sonra birlikdə yollarına davam etdilər. Əbu Bəkr insanlara həcc etdirdi. O zaman ərəblər cahiliyyə dövründə olduğu kimi öz həcc mərasimlərini yerinə

---

[795] “Musnəd Əhməd”, 13/356 (7977); Şeyx Şueyb isnadının həsən olduğunu yazır. “Sunən ən-Nəsai”, 5/408 (2958) ər-Risələ çapı.

yetirirdilər. Qurban günü gəldikdə, Əli - Allah ondan razı olsun - ayağa qalxıb Peyğəmbərin - salləllahu aleyhi və səlləm - ona əmr etdiyini elan etdi: 'Ey insanlar! Heç bir kafir cənnətə daxil olmayacaq. Bu ildən sonra heç bir müşrik həcc etməyəcək. Heç kim Kəbəni lüt şəkildə təvaf etməyəcək. Peyğəmbər - salləllahu aleyhi və səlləm - tərəfindən bağlanmış hər hansı bir əhd, onun müddəti başa çatanadək qüvvədədir.' Bundan sonra insanlara dörd ay möhlət verildi ki, hər bir tayfa öz təhlükəsiz yerinə və ya vətəninə qayıtsın. Bu müddətdən sonra Peyğəmbərlə - salləllahu aleyhi və səlləm - bağlanmış əhdi hələ qüvvədə olanlar istisna olmaqla heç bir müşrikə əhd və aman qalmadı. Beləliklə, bundan sonra heç bir müşrik həcc etmədi və heç kim Kəbəni lüt şəkildə təvaf etmədi. Daha sonra Əli və Əbu Bəkr Peyğəmbərin - salləllahu aleyhi və səlləm - yanına qayıtdılar." İbn İshaq deyir: "Bu, Bəraət surəsinin, müşriklərdən olub da, ümumi və ya müəyyən bir müddətə qədər əhd bağlayanlarla bağlı olan hissəsi idi."[796] İmam Muhəmməd əl-Baqir'dən gələn bu xəbərdə gördüyümüz kimi Əbu Bəkrin həcc əmiri olaraq qaldığı xəbər verilir. Ona görə də İmam ət-Tahavi bu xəbərləri ələ aldıqda buyurur: "Çünki həmin həccdə əmrlik yalnız Əbu Bəkrə məxsus idi, bu işdə onun heç bir şəriki yox idi və orada əmr və qadağa işlərində itaət yalnız Əbu Bəkrə idi, başqasına yox. Buna görə də Əbu Hüreyrəni və onunla olan müəzzinləri göndərdi ki, Peyğəmbər - salləllahu aleyhi və səlləm - tərəfindən Əliyə - radıyallahu anhu - tapşırılan işlərdə onun əmr etdiyi şeylərə itaət etsinlər." Daha sonra Əbu Hureyra'nın oğlunun atasından rəvayət etdiyi hədisi qeyd edir və deyir: "Bu da onu göstərir ki, Əbu Hüreyrənin çağırışı ancaq Əlinin ona diktə etdiyi şeylərlə idi və onun Əliyə yönləndirilməsi də Əbu Bəkrin əmri ilə olmuşdu; çünki əmirlik ona məxsus idi, o həmin həcdə qayıdıb yenidən Peyğəmbərin - salləllahu aleyhi və alih - yanına dönənə qədər insanlara əmr edən şəxs idi. Bəyan etdiklərimizdə həmçinin Əbu Bəkrin - radıyallahu anhu - dərəcəsinin yüksəkliyi açıq-aydın bəlli olur; çünki o, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - adından yalnız Əlinin təbliğ edə biləcəyi bir işdə təbliğçinin üzərində əmir idi. Eyni zamanda bu hadisə Əlinin - radıyallahu anhu - üstün mərtəbəsini də göstərir; çünki Peyğəmbər - salləllahu aleyhi və səlləm - bu xüsusi təbliğ vəzifəsini məhz ona həvalə etdi. Buna görə də elm əhli hər birinin məqamını olduğu kimi bilməli, Allahın onlar üçün müəyyən etdiyi dərəcəni tanımalı və onlardan heç birinin məqamını

[796] "Siratu İbn Hişəm", 2/545-546;

azaltmamalıdırlar."[797] Allah İmam ət-Tahavi'dən razı olsun, həqiqətən də çox önəmli nöqtəyə toxunmuşdur. Əgər Əli bin Əbi Talib'in - radiyallahu anhu - bu hadisədəki məziyyəti və fəziləti, Peyğəmbərin - salləllahu aleyhi va səlləm - adından əhdin pozulması xəbərini təbliğ etməklə xüsusiləşdirilməsidirsə Əbu Bəkrin fəziləti bu təbliğçinin üzərində əmir olaraq vəzifələndirilmiş olması idi. İbn Cərir ət-Təbəri isnadı ilə rəvayət edir ki, Əbus-Sahbə əl-Bəkri deyib: "Mən Əli ibn Əbi Talib'ə "Böyük Həcc" günü barədə sual verdim. O dedi: Allahın Rəsulu - salləllahu aleyhi va səlləm - Əbu Bəkr ibn Əbi Quhafəni insanlara həcci icra etdirmək üçün göndərdi və məni də onunla birlikdə "Bəraət" surəsindən qırx ayə ilə göndərdi. Ta ki, Arafə günü gəldi. Əbu Bəkr Arəfə günü insanlara xütbə verdi. Xütbəsini tamamladıqdan sonra mənə tərəf dönüb dedi: "Ey Əli, qalx və Allahın Rəsulunun - salləllahu aleyhi va səlləm - risalətini çatdır." Mən də qalxdım və onlara "Bəraət" surəsindən qırx ayəni oxudum. Sonra biz Arafədən ayrıldıq, Minaya gəldik, orada daş atdım, qurbanlıq dəvəni kəsdim və başımı qırxdım. Sonra anladım ki, camaatın hamısı Əbu Bəkrin Arafə günü oxuduğu xütbəyə çatmamışdı. Bu səbəblə çadırları bir-bir dolaşaraq o ayələri onlara oxuyurdum. Sizin Qurban gününü Böyük Həcc günü hesab etməyiniz də buradan qaynaqlanır. Halbuki o gün Arafə günüdür."[798]

Peyğəmbərin - aleyhissalətu vassələm - nə üçün Əlini bu işdə xüsusiləşdirdiyi soruşulsa deyərik ki, bu əqdləri, sazişləri pozmaqla bağlı ərəblərin arasındakı adətdən irəli gəlirdi. Əbu Bəkr İbn əl-Arabi buyurur: "Əbu Said Muhəmməd bin Tahir əş-Şəhid'i belə deyərkən eşitdim: Ustaz Əbul-Muzaffər Tahir bin Muhəmməd Şahpuru belə deyərkən eşitdim: "Peyğəmbər - salləllahu aleyhi və səlləm - 'Bəraət' surəsinin təbliği üçün Əbu Bəkr ilə yanaşı Əlini ona görə göndərdi ki, çünki 'Bəraət' surəsi Peyğəmbərin - salləllahu aleyhi və səlləm - bağladığı əhdin ləğvini ehtiva edirdi. Ərəblərin adəti belə idi ki, bir əhdi yalnız onu bağlayan və ya onun ailəsindən olan bir şəxs poza bilərdi. Peyğəmbər - salləllahu aleyhi və səlləm - isə ərəblərin qarşısında hüccəti tamamlamaq və dillərini kəsmək istədi, buna görə də əhdin ləğvini öz əhli beytindən, Haşimilərdən olan əmisi oğluna həvalə etdi ki, ərəblərin buna qarşı danışmağa heç bir bəhanəsi qalmasın."[799] Həmçinin Bədruddin əl-Ayni buyurur: "Əgər desən ki, bəs Bəraət surəsinin

---

[797] ət-Tahavi, "Şərh Muşkil əl-Əsər", 9/225-226;

[798] "Təfsir ət-Təbəri", 14/113; Dərut-Tərtbiyə çapı. Kitabın mühəqqiqləri isnadının səhih olduğunu yazırlar.

[799] İbnul-Arabi, "Əhkəmul-Quran", 2/453;

təbliğini Əliyə təhvil verməsindəki hikmət nə idi?" Deyirəm: çünki 'Bəraət' surəsi əhdin ləğvini ehtiva edirdi. Ərəblərin adəti belə idi ki, bir əhdi yalnız onu bağlayan və ya onun ailəsindən olan bir şəxs poza bilərdi. Peyğəmbər - aleyhissalətu vassələm - isə ərəblərin inkar üçün gətirəcəyi bəhanələrin qarşısını almaq istədi və əhdin ləğvini öz əhli beytindən olan Haşimilərdən əmisi oğluna həvalə etdi ki, onların danışacaq bir sözləri qalmasın."[800] əl-Xazin ləqəbi ilə tanınmış Aləuddin Əbul-Həsən Əli bin Muhəmməd əş-Şihi deyir: "Bəziləri güman edə bilər ki, *Bəraət* surəsinin əvvəlinin oxunması üçün Əli ibn Əbu Talibin göndərilməsində Əbu Bəkrin əmirlikdən azad edilməsi və onun Əbi Bəkrdən üstün tutulması mənası var. Bu isə belə güman edən şəxsin nadanlığındandır. Əbu Bəkrin həmin ildə hələ də mövsümün əmiri olduğunu göstərən dəlil Əbu Hureyrə'dən gəlmiş daha əvvəl təqdim etdiyimiz hədisinin əvvəlidir ki, orada Əbu Bəkrin onu camaat arasında azan vermələri üçün bir dəstə içində göndərdiyi qeyd olunur. Əbu Davud və ən-Nəsainin rəvayətində isə belə deyilir: "Əbu Bəkr məni Minada qurban bayramı günü camaata elan etmək üçün göndərdi ki, bu ildən sonra artıq heç bir müşrik həcc etməyəcək və evin (Kəbənin) ətrafında çılpaq dolanmayacaq." Onun "Əbu Bəkr məni göndərdi" deməsi Əbu Bəkrin hələ də camaatın əmiri olduğunu və onların həcc işlərini onun icra etdiyini, onlara həcc qaydalarını onun öyrətdiyini göstərir. Alimlər isə Peyğəmbərin - salləllahu aleyhi və səlləm - Əlini camaat arasında *Bəraət* surəsini elan etmək üçün göndərməsini belə izah etmişlər: ərəblərin adətinə görə bir əhdi təsdiq etmək və ya onu pozmaq yalnız qəbilə başçısına və ya onun yaxın qohumlarından birinə aid olurdu. Əli ibn Əbu Talib isə Peyğəmbərə - salləllahu aleyhi və səlləm - Əbu Bəkrdən daha yaxın idi, çünki o, onun əmisi oğlu və qohumlarından idi. Buna görə də Peyğəmbər - salləllahu aleyhi va səlləm - onu göndərdi ki, bu üzrü aradan qaldırsın və ərəblər "bu, əqdi bağlamaq və pozmaqda adətimizdən bildiklərimizə ziddir" deməsinlər."[801] İbn Teymiyyə də eyni mənanı təsdiqləyərək buyurur: "Sonra Peyğəmbər - salləllahu aleyhi və səlləm - Təbukdan qayıtdıqda Əbu Bəkri mövsümün (həccin) əmiri təyin etdi ki, həcci yerinə yetirsin, camaata namaz qıldırsın və elan etsin ki, bu ildən sonra artıq heç bir müşrik həcc etməyəcək və evin (Kəbənin) ətrafında çılpaq dolanmayacaq. Əlini isə ona tabe olaraq göndərdi ki, əhdlərin pozulmasını elan etsin; çünki ərəblərin adəti belə idi ki, yalnız qəbilə

---

[800] əl-Ayni, "Umdətul-Qari", 4/78;

[801] əl-Xazin, "Lubəb ət-Təvil fi Məani ət-Tənzil", 2/335;

başçısından və ya onun ailəsindən olan bir adamdan bunu qəbul edirdilər."[802] əl-Qadi Abdulcabbar öz mötəzili şeyxlərindən, daha dəqiq desək Əbu Əli əl-Cubbəi'dən belə dediyini nəql edir: "Burada məqsəd odur ki, ərəblər arasında belə bir adət vardı: onların qəbilələrindən birinin böyüyü bir əhd bağlayarsa, o əhd yalnız onun özü və ya həmin qəbilənin digər böyüklərindən biri tərəfindən pozula bilərdi. Belə ki, bu onların adəti olduğu üçün, Allahın Rəsulu - aleyhissəlləm - onlarla müəyyən işlər barəsində əhd bağlamışdı və indi bu əhdi onlara pozaraq çatdırmaq və aralarındakı razılaşmaları ləğv etmək istədikdə bildi ki, onların əhdini ancaq özü və ya öz soyunun böyüklərindən biri poza bilər. Peyğəmbər - aleyhissəlləm - isə Haşimi nəslindən idi, Əbu Bəkr isə Teym nəslindən idi və onların arasında nəsəb baxımından bir uzaqlıq vardı. Buna görə də, Əliyə əmr etdi ki, Əbu Bəkirdən yazını alsın və bildirdi ki, bu işi onun yerinə ancaq öz soyundan olan bir şəxs yerinə yetirə bilər. Burada "özündən olan şəxs" dedikdə isə, öz qəbiləsini və Əhli-beytini nəzərdə tuturdu, səbəb isə qeyd etdiyimiz məsələ idi."[803]

ət-Tabətabəi'nin təbliğ etmək məqamı ilə bağlı dediklərinə gəldikdə isə bunun rəvayətlərdə heç bir əsası yoxdur. Bu da digər rəvayətlərdə olduğu kimi mətnlərin içindən gizli mənalar çıxarmaq cəhdlərindən başqa bir şey deyildir. Bu hadisə izah etdiyimiz kimi "Bəraət" surəsinə xas bir hal idi, çünki orada müşriklərlə bağlanan ümumi sazişin müddəti təyin olunurdu. Digər məsələlərdə təbliği isə digər səhabələrə də aid edib. Peyğəmbər - aleyhissalətu vassələm - Məkkədə sonuncu xütbəsini verdikdən sonra orada iştirak edənlərə xitab edərək demişdi: "Burada olanlar olmayanlara təbliğ etsin, ola bilsin ki, eşidənlər özündən daha anlayışlı birinə təbliğ etmiş olsun!"[804] Bununla bağlı Muhəmməd Raşid Rida deyir: "Bəzi şiələr – adətlərinə uyğun olaraq – bu məziyyəti Əli üçün şişirdirlər və ona rəvayət baxımından səhih olmayan, dirayət baxımından dəstək görməyən şeylər əlavə edirlər. Onlar bununla Əbu Bəkr - radıyallahu anhu - üzərində Əlinin üstünlüyünü və onun xilafətə daha layiqli olduğunu sübut etməyə çalışırlar. İddia edirlər ki, Peyğəmbər - salləllahu aleyhi va sələm - Əbu Bəkri "Bəraə" surəsini təbliğ etmək vəzifəsindən azad etmişdir; çünki bunu ona Cibril belə əmr etmiş və buyurmuşdur ki, onun adından yalnız onun özündən olan biri bu təbliği yerinə yetirə

[802] "Məcmu əl-Fətəva", 7/599;

[803] əl-Qadi Abdulcəbbar, "əl-Muğni", 20-1/351

[804] "Sahih əl-Buxari", 67, 4144, 5230, 7009; "Sahih Muslim", 1679

bilər. Onlar bu inkarı yalnız əhdlərin ləğvi və ona aid məsələlərlə xüsusiləşdirmirlər, əksinə bütün din işlərinə aid olduğunu iddia edirlər. Halbuki mustəfid dərəcəsindəki səhih xəbərlərdən bilinir ki, dinin təbliğinin – cihadla onu qorumaq və müdafiə etmək, bunun təkcə fəzilət yox, həm də tərz olması kimi – müsəlmanların hamısının üzərinə vacibdir. Məsələn, Peyğəmbər - salləllahu aleyhi va səlləm - vida həccində minlərlə insanın eşitdiyi bir halda buyurmuşdur: “Qoy burada olanlar olmayanlara çatdırsınlar.” Bu, həm iki "əs-Səhih" kitabında, həm də başqalarında təkrarlanır. Bəzi rəvayətlərdə İbn Abbasdan belə nəql olunur: “Canımı əlində tutan Allaha and olsun, bu söz onun ümmətinə son vəsiyyətidir: “Qoy şahid olanlar eşitməyənlərə çatdırsınlar!” Həmçinin "Məndən, bir ayə olsa belə, çatdırın" hədisini də əl-Buxari “əs-Sahih” kitabında və ət-Tirmizi rəvayət ediblər. Əgər belə olmasaydı, İslam dünyaya bu qədər sürətlə yayılmazdı. Halbuki bəziləri – deyildiyinə görə – iddia etmişlər ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - Əbu Bəkrin həcc əmiri olmasını ləğv edib Əlini ona üstün tutmuşdur. Bu isə açıq-aydın bir iftiradır və bütün səhih rəvayətlərə ziddir. Çünki bu məsələdə, yəni o ilki həcdə Əbu Bəkrin həcc əmirliyi məsələsində, həm xüsusi, həm də ümumi müsəlmanlar ittifaq etmişdir. Doğrusu budur ki, Əli – kərraməllahu vachəhu – müəyyən bir məsələni çatdırmaq üçün vəzifələndirilmişdi. O, həmin həccdə İslamın ictimai sütununun yerinə yetirilməsi işində Əbu Bəkrin ümumi əmirliyinə tabe idi. Hətta Əbu Bəkr, ona bu xəbəri çatdırmaq üçün vaxt təyin edir və deyirdi: "Ey Əli, qalx və Allahın Rəsulunun risalətini çatdır." Bu, səhih rəvayətlərdə açıq şəkildə bəyan olunmuşdur. Həmçinin bəzi səhabələrə Əliyə bu çatdırmaq işində kömək etməyi əmr etmişdir. Bu da Əbu Hüreyrənin iki "əs-Səhih" kitabında və başqa qaynaqlarda keçən hədisində daha əvvəl qeyd olundu.”[805] Aydındır ki, Şeyx Muhəmməd Raşid Rida’nın söylədiyi kimi məsələdə Əbu Bəkrin əleyhinə olacaq və ya Əlinin daha əfzəl olduğunu, xəlifəliyə daha layiq olduğunu isbat edəcək heç bir dəlil yoxdur. Burada biz deyə bilərik ki, əgər Allahın elçisinin - salləllahu aleyhi va səlləm - adından “bəraət” surəsini təbliğ etmək bu dərəcədə böyük bir fəzilət və məziyyətdirsə o zaman Allahın elçisinin birinci dəfə Əbu Bəkri buna layiq görməsi sabit olmuşdur. Əgər Əbu Bəkr buna əvvəlcədən layiq olmasaydı Allahın elçisinin onu təyin etməsi bir qüsur olardı. Üstəlik “bəraətin” təbliğini etmək üçün öz əmisi oğlu Əlinin göndərdikdə onu Əbu Bəkrin əmirliyinə tabe tutması bir daha Əbu Bəkrin fəzilətinə dəlalət edir və

---

805 Raşid Rida, “Təfsirul-Mənar”, 10/145;

onun xilafət məqamına layiq olduğunu göstərir. Şiə raviləri bu problemi başa düşdükləri üçün bunu həll etməkdən ötrü imamların adından bəzi rəvayətlər uydurublar. Bu uydurma əməliyyatı koordinasiyasız baş verdiyi üçün yenə də ziddiyyətə düşüblər. Bir rəvayətdə Əbu Rafi deyir: “Allahın elçisi - salləllahu aleyhi va əlihi - “bəraət” surəsini Əbu Bəkr ilə göndərdikdə Allah ona vəhy endirdi: “Dəfələrlə xəlvətdə söhbət etdiyim şəxsi buraxıb heç söhbət etmədiyim birini göndərirsən?!” Bunun üzərinə Peyğəmbər - salləllahu aleyhi va əlih - (Əbu Bəkrə) adam göndərdi və ondan "bəraət” (surəsin)i aldı və onu Əliyə - aleyhissalam - verdi. Əli - aleyhissalam - dedi: “Ey Allahın Rəsulu, mənə tövsiyə et!” Peyğəmbər - salləllahu aleyhi va əlih - buyurdu: “Allah sənə vəsiyyət edəcək və səninlə xəlvətdə danışacaqdır.” Beləliklə də "bəraət" günündə ilk namazdan əvvəl asr namazına qədər onunla xəlvətdə söhbət etdi.”[806] Bu rəvayətdə Əli haqqında aşırı etiqad özü belə rəvayətin uydurma olduğunu görmək üçün kifayət edir, bunun heç sənədinə baxmağa və onu analiz etməyə ehtiyac yoxdur. Lakin bəzi şiə raviləri problemi kökündən həll etmək üçün dedilər ki, Peyğəmbər - aleyhissalətu vassələm - ümumiyyətlə Əbu Bəkrə heç əvvəldən təbliğ vəzifəsi verməmişdi. Zurara iddia edir ki, İmam Muhəmməd əl-Baqir’i belə deyərkən eşidib: “Xeyr, Allaha and olsun ki, Allahın elçisi - salləllahu aleyhi va əlihi - Əbu Bəkri “bəraət” surəsi ilə göndərməmişdi. Heç olan işdirmi ki, Əbu Bəkri onunla göndərsin, sonra da ondan geri alsın?! Lakin onu həccin üzərində əmir təyin etdi, sonra onu o vəzifədən ayırdıqdan sonra “bəraət” surəsini Əli ilə göndərdi. Əlini göndərəndə isə ona dedi: “Mənim yerimə bunu ancaq mən və sən çatdıra bilərik.”[807] İmamın adından bu rəvayəti uyduranlar sözün həqiqi mənasında tarixi saxtalaşdırırlar. Hətta əş-Şərif əl-Murtəda belə etiraf etməli olur ki, xəbərlərin əksəriyyəti Əbu Bəkrin həmin il insanlara həcc etdirdiyini deyir və qeyd edir ki, bunun əksini deyən bəzi xəbərlər isə şiələrdən gəlir.[808] Biz əş-Şərif əl-Murtəda’nın qəsd etdiyi xəbərlərin bəziləri ilə tanış olduq. Əlbəttə ki, bu xəbərlər heç bir şəkildə tarixi həqiqətləri dəf etmək üçün kifayət etməz.

Şiələrin gətirdikləri rəvayətlərdən biri də vasilik haqqında varid olmuş hədisdir. “Fədail əs-Sahabə” kitabında bu hədis belə zikr olunur: “Heysəm bin Xaləf bizə rəvayət etdi; Muhəmməd bin Əbi Ömər əd-Duri bizə rəvayət etdi; Şəzən bizə rəvayət etdi; Cəfər bin Ziyad bizə

---

[806] əs-Saffər, “Bəsair əd-Dəracət”, səh: 411;

[807] “Təfsir əl-Ayyəşi”, 2/47; əl-Məclisi, “Bihərul-Ənvar”, 35/295;

[808] bax: “əş-Şəfi fil-İməmə”, 4/155;

Mətar'dan, o da Ənəs bin Malik'dən rəvayət etdi; dedi: "Salmana dedik: "Peyğəmbərdən – salləllahu aleyhi va səlləm – vasisi haqqında soruş!" Salman da ona dedi: "Ey Allahın elçisi, sənin vasin kimdir?" Dedi: "Ey Salman, Musanın vasisi kim idi?" Dedi: "Yuşə bin Nun." Dedi: "Beləliklə də mənim də vasim, varisim, borcumu ödəyən və vədimi yerinə yetirən; Əli bin Əbi Talibdir."[809] Maraqlıdır ki, bu rəvayəti də Ənəs bin Malik'dən rəvayət edirlər. Bu rəvayət əl-Qati'inin etdiyi əlavələrdəndir. İsnadındakı Muhəmməd bin Əbi Ömər əd-Duri məchuldur. Cəfər bin Ziyad şiədir, haqqında ixtilaf edilib. Əsas problem bunu Ənəsdən rəvayət edən Mətar bin Meymun'dadır; ona gəldikdə əl-Buxari, Əbu Hətim ər-Razi, Əbul-Qasim əl-Bəlxi, Əbu Cəfər əl-Uqeyli onu "münkərul-hədis" adlandırıblar[810] və bu, onun rəvayətlərinin münkər, şiddətli dərəcədə zəif olması deməkdir. İbn Hibban onun haqqında deyir ki, "sabit ravilərdən uydurma xəbərlər rəvayət edir, Ənəs'dən Əli bin Əbi Talibin və başqasının fəziləti ilə bağlı Ənəsin demədiyi hədisləri rəvayət edir."[811]

Onu da qeyd edim ki, əhlüs-sünnət kitablarında məşhur olan ğadir, mənzilə kimi rəvayətləri bəzən şiə raviləri öz anladıqları mənada, daha dəqiq desək öz məzhəblərinə müvafiq şəkildə rəvayət edirlər. Bu ravilərin bir hissəsi əhlüs-sünnət ricəl kitablarında saduq hesab olunsalar da onların bu şəkildə rəvayət etdikləri xəbərlər məqbul deyildir, çünki etibar və say cəhətdən özlərindən daha üstün olan ravilərə müxalif olublar. Bunlardan biri Ğadir hədisinin alternativ ləfzidir. İmam Əbu Davud ət-Tayəlisi deyir: "Cəfər ibn Suleyman əd-Dubəi bizə rəvayət etdi; Yezid ər-Rişk bizə Mutarrif ibn Abdilləh bin əş-Şixxir'dən, o isə İmran ibn Husayn'dən rəvayət etdi ki, "Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əlini bir orduda göndərdi. Ondan bir şey gördülər və inkar etdilər. (Ordudan) dörd nəfər ittifaq etdi və Əlinin nə etdiyini peyğəmbərə - salləllahu aleyhi va səlləm – xəbər verəcəyinə dair razılaşdılar." İmran dedi: "Biz səfərdən qayıtdıqda Allahın elçisinin – salləllahu aleyhi va səlləm – yanına gəlib, ona salam verib ona baxmadan ailəmizin yanına getməzdik. Beləliklə də həmin dörd nəfər gəldi və onlardan biri duraraq dedi: "Ey Allahın elçisi, görmürsənmi ki, Əli bunları və bunları elədi?" (Peyğəmbər) ondan üz çevirdi. Sonra

---

[809] "Fədail əs-Sahabə", 1052

[810] əl-Buxari, "ət-Tərix əl-Kəbir", 7/401-402; əl-Muallimi çapı. İbn Əbi Hətim ər-Razi, "əl-Cərh vat-Tədil", 8/287 (1317); əl-Bəlxi, "Qabulul-Əxbər va Mərifətur-Ricəl", 2/325 (780); əl-Uqeyli, "əd-Duafə əl-Kəbir", 4/219 (1809);

[811] İbn Hibban, "əl-Məcruhin", 3/ 5;

ikincisi qalxdı və eynisini söylədi. Ondan da üz çevirdi. Sonra üçüncü qalxdı və eyni sözləri söylədi və ondan da üz çevirdi. Sonra dördüncü qalxıb eyni sözləri dedikdə Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Əlidən sizə nə var?! Şübhəsiz ki, Əli məndəndir, mən də ondanam və o, məndən sonra bütün möminlərin vəlisidir."[812] Bu hədisi İmran bin Huseyn'dən yalnız Cəfər bin Süleyman bu ləfz ilə rəvayət etmişdir. ət-Tirmizi bu hədisi zikr etdikdən sonra deyir: "Bu, həsən ğarib bir hədisdir. Biz bunu yalnız Cəfər bin Süleyman'ın hədisindən bu vəch ilə bilirik."[813] əz-Zəhəbi'nin də təsdiqlədiyi kimi bunu yalnız Cəfər bin Süleyman rəvayət etmişdir. Ona görə də rafizilikdə ittiham edilmiş, bəzən münkər xəbərlər rəvayət etmiş belə bir ravinin öz məzhəbini dəstəkləyən bir xəbəri rəvayət etməsi heç cür qəbul edilə bilməz, xüsusilə də İmran bin Huseyn'dən bunu ondan başqa heç kim rəvayət etməmişdir. Məlumdur ki, bu hədisin əsli məşhur "ğadir-xum" hədisidir və orada peyğəmbərin – aleyhissalətu vassələm – Əli haqqında söylədiyi sözlər belədir: "Mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır." İbnul-Qeysərani adı ilə tanınan Alləmə Əbul-Fədl Muhəmməd bin Tahir əl-Məqdisi əş-Şeybəni (vəfatı hicri 507) bu hədisi "Zəxiratul-Huffəz" kitabında zikr etdikdən sonra deyir: "Bu hədis bu Cəfər ilə tanınır və o, şiəlikdə aşırı idi."[814] Bununla da İbnul-Qeysərani bu hədisin məqbul olmadığını ifadə edir. İmam Şəmsuddin əz-Zəhəbi "Tərixu İsləm" kitabında deyir: "Bunu Quteybə, Bişr bin Hiləl və bir qrup Cəfər'dən rəvayət ediblər və Cəfərə bu rəvayətində başqa heç kim tabe olmayıb. Bunu ən-Nəsəi və ət-Tirmizi rəvayət edib və (ət-Tirmizi) deyib: "Hədis həsəndir, ğaribdir." Bunu İmam Əhməd "əl-Müsnəd" kitabında Abdurrazzəq'dən və Affən'dən onun (yəni Cafərin) vasitəsilə rəvayət edib. İsnadı Muslim'in şərtinə görədir, lakin sadəcə olaraq (hədis) münkər olduğu üçün onu "əs-Sahih" kitabında rəvayət etməyib."[815] əz-Zəhəbi başqa kitabında bu hədisi zikr etdikdən sonra deyir: "Bu, Cəfərin tək rəvayət etdiklərindəndir." Beləliklə də İmam əz-Zəhəbi də bu hədisin münkər olduğunu təsdiqləmişdir. Hətta bir yerdə deyir: "Onun "o, məndən sonra hər bir möminin vəlisidir" sözü Allahın elçisinin - salləllahu aleyhi va səlləm - adına yalandır…"[816]

---

[812] "Musnəd Əbi Davud ət-Tayəlisi", 2/186 (868); İbn Əbi Şeybə, "əl-Musannəf", 18/75 (34293); "Musnəd Əhməd", 33/154 (19928) ər-Risələ; "Sunən ət-Tirmizi", 4045

[813] "Sünən ət-Tirmizi", 6/286 (4046);

[814] İbn əl-Qeysərani, "Zəxiratul-Huffəz", 2/1103; Darus-Sələf

[815] əz-Zəhəbi, "Tərixu İsləm", 11/36; ət-Təvfiqiyyə

[816] əz-Zəhəbi, "əl-Muntəqa min Minhəc əl-İtidəl", səh: 475;

Yezid ər-Rişk'dən ümumiyyətlə Həmməd bin Sələmə, Həmməd bin Zeyd, İsmayıl bin Uleyyə, Abdulvaris bin Said, Şubə bin əl-Həccəc, Məmər bin Raşid, Əbən bin Yezid əl-Attar, Əbu Qudəmə əl-Həris bin Ubeyd İyədi, Süleym bin Həyyən və başqaları rəvayət edirlər. Lakin İmran bin Hüseyn'dən gəlmiş bu hədisi Yezid ər-Rişkdən yalnız Cəfər bin Süleyman rəvayət edirsə və Cəfərin tənqid olunmuş bir ravi olduğunu, xəta edən biri və rafizi olduğunu biliriksə belə bir rəvayət heç cür qəbul oluna bilməz. Bəzi müasir və qədim alimlərimizin bu hədisin isnadını səhih saymaqları heç də hədisdəki ləfzin də o şəkildə sabit olduğunu təsdiqləməkləri anlamına gəlməməlidir, çünki bu ləfzi səhih sayanlar onu digər ləfzlərə müvafiq şəkildə anlayıblar. Şeyx Şueyb əl-Arnavut'un bu hədisin isnadını güclü saymasına gəldikdə isə bu, onun daha əvvəlki rəyi idi. Lakin daha sonra İmam Əhmədin "əl-Müsnəd" kitabına yazdığı təhqiqində son görüşünü belə ifadə etmişdir: "İsnadı zəifdir; Cəfər bin Süleyman – və o, əd-Dubə'idir – tənqid olunub, şiə idi və İbn Adiy "əl-Kəmil" kitabında bu hədisi onun münkər sayılmış hədisləri arasında qeyd etmişdir, həmçinin qarşıda gələcəyi kimi İbn Teymiyyə də (münkər sayıb). Biz isnadını İbn Hibban(ın kitabının təhqiqin)də gücləndirmişdik, ona görə də buradan düzəliş edilməlidir."[817]

Burada belə bir etiraz edə bilərlər ki, bu ləfz başqa yolla da rəvayət olunub. İmam Əhməd deyir: "İbn Numeyr bizə rəvayət etdi: Əcləh əl-Kindi mənə Abdullah bin Bureydə'dən, o da atası Bureydə'dən belə dediyini rəvayət etdi: "Allahın elçisi – salləllahu aleyhi va sələm – Yəmənə iki ordu göndərdi; onlardan birinə Əli bin Əbi Talibi, digərinə isə Xalid bin əl-Validi təyin etdi və dedi: "Əgər bir yerə gəlsəniz o zaman Əli hamınızın əmiridir, əgər ayrılsanız hər biriniz öz ordusunun əmiridir." Dedi: "Yəmən əhlindən Zeyd oğulları ilə qarşılaşdıq, vuruşduq və müsəlmanlar müşriklərə qalib gəldi; döyüşçüləri öldürdük, zürriyyətlərini əsir aldıq və Əli əsir alınmışların arasında özünə bir qadını seçib götürdü." Bureydə dedi: "Xalid bin əl-Valid Allahın elçisinə - salləllahu aleyhi va sələm – bunu xəbər verən bir məktub yazıb mənimlə göndərdi. Allahın elçisinin – salləllahu aleyhi va sələm – yanına gəldikdə məktubu verdim və (məktub) onun üçün oxundu. Bundan sonra Allahın elçisinin – salləllahu aleyhi va sələm – üzündə qəzəbi gördüm və dedim: "Ey Allahın elçisi, burada sənin əfvinə sığınmaq yeridir; məni bir nəfər ilə yolladın və ona itaət etməyi əmr

[817] "Musnəd Əhməd", 33/154-155, ər-Risələ;

etdin və mən də nə üçün göndərilmişəmsə onu edirəm.” Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Əlini təhqir etmə, çünki o, məndəndir və mən ondanam və o, məndən sonra sizin vəlinizdir. O məndəndir, mən də ondanam və o, məndən sonra sizin vəlinizdir.”[818] Bureydə’dən rəvayət olunan bu xəbər qismən İmran bin Hüseyn’dən rəvayət olunan xəbərdən fərqlənir. Çünki birincisində şikayət edənin Xalid bin əl-Valid olduğu, ikincisində isə şikayət edənlərin dörd ayrı səhabə olduğu qeyd edilir. Lakin bu hədis də bu ləfz ilə səhih deyildir. Çünki isnadında Əcləh əl-Kindi adlı ravi vardır. Gəlin birlikdə onunla tanış olaq. Tam adı Əcləh bin Abdilləh bin Huceyyə’dir, kunyəsi Əbu Huceyyə’dir. Əcləh’in onun adı olmadığını, sadəcə ləqəbi olduğunu deyiblər, adının Yəhya olduğunu söyləyirlər. əl-Hafiz əl-Mizzi deyir: “Əli bin əl-Mədini, Yəhyə bin Said əl-Qattan’dan (belə dediyini) nəql etdi: “Nəfsimdə ona qarşı bir şey var.” Amr bin Əli isə Yəhyə bin Said (əl-Qattan)dan nəql edir: “O, Əli bin əl-Hüseyn ilə Hüseyn bin Əli’ni ayıra bilməzdi.”[819] Əbu Talib Əhməd bin Hənbəl’dən nəql etdi: “Əcləh və Mücalid hədisdə bir-birinə yaxındır, əl-Əcləh birdən çox münkər hədis rəvayət edib.”… Abbas əd-Duri isə Yəhyə bin Main’dən nəql edir: “Siqadır.” Bir başqa yerdə deyib: “Onda bir bəis yoxdur.” İshaq bin Mənsur isə Yəhyə bin Main’dən nəql edib: “Salehdir.” Osman bin Said əd-Dərimi isə Yəhya (bin Main)dən nəql edib: “Siqadır.” Əhməd bin Abdilləh əl-İcli deyib: “Kufəlidir, siqadır.” Əbu Hatim (ər-Razi) deyib: “Güclü deyildir, hədisi yazılar, lakin hüccət kimi götürülməz.”[820] ən-Nəsəi deyib: “Zəifdir, elə güclü deyildir və onun pis məzhəbi var idi.”[821] əl-Cəvzəcəni deyir: “İftiraçıdır.”[822] Əbu Əhməd bin Adiy deyir: “Onun saleh hədisləri vardır, ondan kufəlilər və qeyriləri rəvayət edir. Onun həddi aşacaq dərəcədə münkər bir hədisini görməmişəm, nə isnad baxımından, nə də mətn baxımından. Sadəcə olaraq o, Kufənin şiələrindən sayılır və mənə görə o, hədisdə müstəqimdir, saduqdur.”…”[823] İbn Sad “ət-Tabəqat” kitabında deyir: “Çox zəif idi.”[824] İbn Hibban onu cərh olunmuş ravilər arasında qeyd edərək deyir: “Nə dediyini dərk etməzdi; Əbu Sufyanı Əbu Zubeyr edərdi və

[818] “Musnəd Əhməd”, 38/117-118, ər-Risələ;
[819] İbn Adiy, “əl-Kəmil fi Duafə ər-Ricəl”, 2/136
[820] İbn Əbi Hətim, “əl-Cərh vat-Tədil”, 2/347 (1317);
[821] ən-Nəsəi, “əs-Sunən əl-Kubra”, 3/402 (rəq: 3396), ər-Risələ çapı.
[822] əl-Cəvzəcəni, “Əhvalur-Ricəl”, səh: 59 (32);
[823] əl-Mizzi, “Təhzib əl-Kəməl”, 2/275-278;
[824] İbn Sad, “ət-Tabəqat əl-Kubra”, 6/350; Dar Sadir

adları dəyişdirərdi..."[825] İmam Əbu Davud onun zəif olduğunu deyib.[826] Alləmə Muğultay deyir: "əs-Səci onun haqqında dedi: "Zəifdir və o, saduqdur."...və Əbu Cəfər əl-Uqeyli deyir: "əş-Şabi'dən qarışıq hədislər rəvayət etmişdir ki, onları ondan başqa heç kim rəvayət etməyib." İbnul-Cərud'un kitabında isə deyir: "Bir şey deyildir." Əbul-Qasim əl-Bəlxi və Əbul-Arab onu zəif ravilər arasında zikr ediblər.... Yaqub bin Sufyan (əl-Fəsəvi) deyir: "Siqadır, hədisi leyyindir."[827] Xülasə olaraq deyə bilərik ki, əksər alimlər əl-Əcləh bin Abdilləh'i zəif sayıblar. Yəhyə bin Said əl-Qattan, ən-Nəsəi, Əbu Davud, Əbu Hatim ər-Razi, əl-Cəvzəcəni, İbn Sad, İbn Hibban, Əbu Cəfər əl-Uqeyli, əs-Səci, İbnul-Cərud, Əbul-Qasim əl-Bəlxi, Əbul-Arab, əd-Dəraqutni və başqaları onu zəif saymış alimlər arasındadır. Yəhyə bin Main, əl-İcli, Amr bin Əli əl-Fəlləs, Yaqub bin Sufyan əl-Fəsəvi, İbn Adiy onu təvsiq edib. İmam Əhməd hədisləri arasında münkərlərin də olduğunu qeyd edib. əz-Zəhəbi və İbn Həcər ona saduq hökmü versələr də, yəni hədisinin həsən dərəcəsində olduğunu söyləsələr də Şueyb Arnavut, Bəşşər bin Avvad əl-Bəğdədi bu hökmlə razılaşmamış, onun zəif olması görüşünü daha doğru saymışlar. Bütün bunlarla yanaşı daha önəmli nöqtə budur ki, əl-Əcləh məzhəbində aşırı şiə olub. İmam ən-Nəsəi deyir: "əl-Əcləh güclü deyildir və şiəlikdə həddini aşırdı."[828] Qayda isə budur ki, bu cür ravilərin öz məzhəblərini dəstəkləyən xəbərləri qəbul olunmur. Bu səbəblə Şeyx Şueyb Arnavut "əl-Müsnəd" kitabının təhqiqində bu hədis barəsində deyir: "Əcləh əl-Kindi – və o, İbn Abdilləh bin Huceyyə'dir - səbəbi ilə bu məzmun ilə (rəvayətin) isnadı zəifdir, çünki (Əcləh) zəifdir..."[829] Ona görə də əl-Hafiz İbn Kəsir bu hədisin ləfzi haqqında deyir: "Bu ləfz münkərdir, əl-Əcləh şiədir və belə bir rəvayəti tək başına onun kimi bir ravi rəvayət edərsə qəbul olunmaz. Bunda ona ondan da zəif olan biri tabe olmuşdur. Doğrusunu Allah bilir. Bunun haqqında doğru və səhih olan Əhmədin Vaki'dən, onun da əl-Aməş'dən, onun isə Sad bin Ubeydə'dən, onun da Abdullah bin Bureydə'dən, onun isə atasından rəvayət etdiyidir: "Dedi: Allahın elçisi – salləllahu aleyhi va səlləm – buyurdu: "Mən kimin vəlisiyəmsə Əli də onun vəlisidir." Bunu yenə Əhməd və əl-Həsən bin Arafə Əbu Muaviyə'dən, o da əl-Aməş'dən eyni isnadla rəvayət edir. Bunu ən-

[825] İbn Hibban, "əl-Məcruhin", 1/175; Zayid çapı.

[826] "Suələt Əbi Ubeyd əl-Əcurri", səh: 179 (180)

[827] əl-Muğlətay, "İkməlu Təhzib əl-Kəməl", 2/14; əl-Faruq çapı

[828] ən-Nəsəi, "əs-Sunən əl-Kubra", 9/228 (rəq: 10377), ər-Risələ çapı.

[829] "Musnəd Əhməd", 38/118, ər-Risələ;

Nəsəi də Əbu Kureyb'dən, o da Əbu Muaviyə'dən bu isnad ilə rəvayət edir."[830] Görə bildiyimiz kimi bunun Bureydə'dən birdən çox yoldan rəvayət edilmiş səhih versiyasında Allahın elçisinin – aleyhissalətu vassələm – söylədiyi sözlər belədir: "Mən kimin vəlisiyəmsə Əli də onun vəlisidir." Buradan da anlaşılır ki, bu ravi bu hədisi öz etiqadına uyğun mənada anladığı üçün o mənada da rəvayət etmişdir.

Bu növdən daha bir rəvayət ilə tanış olaq. Əbu Davud ət-Tayəlisi deyir: "Əbu Avanə bizə Əbu Bəlc'dən, o da Amr bin Məymun'dan, o isə İbn Abbas'dan rəvayət etdi ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əliyə dedi: "Sən məndən sonra bütün möminlərin vəlisisən."[831] Bu hədis əslində İbn Abbasdan rəvayət olunan çox uzun bir hədisdən yalnız bir cümlədir. Hədisi tam mətni ilə İmam Əhməd "əl-Müsnəd" kitabında, İbn Əbi Asim "əs-Sünnə" kitabında rəvayət edir.[832] Əhmədin müsnədinə və İbn Əbi Asimin kitabına baxdıqda görürük ki, bu hədis məşhur mənzilə hədisidir. Bu rəvayət isə isnadındakı Əbu Bəlc ətrafında dolanır. Ona görə də gəlin Əbu Bəlc ilə də tanış olaq. Əbu Bəlcin adı üzərində ixtilaf ediblər. Məşhur olan budur ki, onun adı Yəhyə bin Süleym əl-Fəzəri əl-Vasiti'dir. İbrahim bin Yaqub əs-Sədi əl-Cəvzəcəni deyir: "Əbu Bəlc, yəni Yəhyə bin Süleym əl-Vasiti...siqa deyildir."[833] İbn Hibban onu cərh olunmuş ravilər arasında zikr edir və deyir: "Xəta edənlərdən idi, tərk olunmağa layiq olacaq dərəcədə xətası ağır deyildir. Bəşərin qurtula bilməyəcəyi bir şey ondan gəlməyib, ona görə də onunla adillərin davrandığı kimi davranmalıyıq. Beləliklə də mənim nəzərimdə onun tək başına rəvayət etdiyi hüccət olaraq götürülməz..."[834] əl-Əzdi də onun siqa olmadığını deyib. İbn Adiy deyir: "Hədisində bir bəis yoxdur."[835] İbn Sad, ən-Nəsəi, Yəhyə bin Main, əd-Dəraqutni onu siqa sayıblar. Əbu Hatim ər-Razi onun haqqında deyir: "Hədisdə salehdir, onda bir bəis yoxdur."[836] Əbu Əhməd əl-Həkim (vəfatı hicri 378) deyir: "Əbu Bəlc və Əbu Saleh də deyilir; Yəhyə bin Əbi Suleym. İbn Əbil-Əsvad əl-Fəzəri əl-Kufi də deyilir. əl-Vasiti də deyilir...Əhməd bin Hənbəl onu zəif saymışdır."[837]

[830] İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 11/59, Turki çapı
[831] "Musnəd Əbi Davud", 4/469 (2875)
[832] "Musnəd Əhməd", 5/178-180; İbn Əbi Asim, "əs-Sunnə", 2/565 (1188);
[833] əl-Cəvzəcəni, "Əhvalur-Ricəl", səh: 198 (190);
[834] İbn Hibban, "əl-Məcruhin", 3/113; Zayid çapı
[835] "əl-Kəmil fi Duafə ər-Ricəl", 9/81;
[836] İbn Əbi Hatim, "əl-Cərh vat-Tədil", 9/153 (634);
[837] əl-Hakim, "əl-Əsəmi val-Kunə", 1/56 (1054);

Başqalarının İmam Əhməddən rəvayət etdiklərində isə o, demişdir: "Münkər bir hədis rəvayət etmişdir." Əbul-Abbas Şihəbuddin əl-Busiri kitabında Əbu Bəlc'in rəvayət etdiyi bir başqa hədisin isnadı haqqında deyir: "Bu, tənqid olunmuş bir isnaddır; Əbu Bəlcin adı barəsində bir neçə rəy üzərində ixtilaf edilib və ədaləti üzərində də ixtilaf edilib. İbn Main, İbn Sad, ən-Nəsəi, əd-Dəraqutni onu siqa sayıb. Əbu Hətim deyib: "Onda bir bəis yoxdur." İbn Hibban "əs-Siqat" kitabında deyir: "Xəta edir." əl-Buxari deyib: "Onda nəzər vardır." əl-Cəvzəcəni və əl-Əzdi isə dedilər ki, "siqa deyildir."[838] əl-Buxari'nin onun barəsindəki hökmünü İbn Adiyy nəql edir.[839] Nuruddin əl-Heysəmi onun haqqında deyir: "Əbu Bəlc əl-Fəzəri siqadır, onda "lin" vardır."[840] Lin isə hafizədəki zəiflikdir, diqqətsizlikdir, gevşəklikdir. əz-Zəhəbi də "əl-Muqtənə" kitabında onun "leyyin" olduğunu, yəni diqqətsiz və gevşək olduğunu deyib.

Əbu Bəlc ilə maraqlandığım müddətdə onun rəvayət etdiyi bir çox rəvayət ilə tanış oldum. Diqqətimi çəkən məqam bu oldu ki, Əbu Bəlc bir çox rəvayətində Əli bin Əbi Talib haqqında – radiyallahu anhu – başqalarının rəvayət etmədiyi xəbərlər rəvayət edir və yaxud da başqalarının rəvayət etdiyi xəbərləri daha fərqli şəkildə, şiə məzhəbinə müvafiq şəkildə rəvayət edir. Etdiyi rəvayətlərdən onun məzhəbi haqqında müəyyən bir təsəvvür formalaşır və onun şiə etiqadında olduğunu anlayırsan, xüsusilə də yaşadığı bölgəni də diqqətə aldıqda bunun belə olduğundan əmin olursan. Lakin qaynaqlarda onun haqqında danışmış ricəl alimləri onun məzhəbi haqqında bir şey yazmamışdılar. Sonunda Hafiz İbn Həcər'in "Bəzlul-Məun" kitabını bununla bağlı nəzərdən keçirdikdə gümanımız doğrulandı. İbn Həcər deyir: "İbnul-Cəvzi nəql edib ki, İbn Main onu zəif sayıb. Əgər bu sabitdirsə ola bilər ki, (İbn Maindən) o və ondan daha güclü biri haqqında soruşublar və (həmin güclü raviyə) nisbətdə onu zəif saymışdır. Bu, İbn Maindən haqqında fərqli rəvayətlər gəlmiş ravilərlə bağlı dəyərli bir qaydadır. Buna Əbul-Valid əl-Bəci "Ricəlul-Buxari" kitabında diqqət çəkmişdir. Həm də ola bilər ki, İbn Main onu sahib olduğu görüşünə görə zəif saymışdır, çünki o, şiəliyə mənsubdur..."[841] Yəhyə bin Main'in onu zəif saydığını təkcə İbnul-Cəvzi yox, həm də

---

[838] əl-Busiri, "İthəful-Xiratil-Məhəra", 1/88;

[839] İbn Adiy "əl-Kəmil fi Duafə ər-Ricəl", 9/80; İbn əl-Cəvzi, "əd-Duafə val-Mətrukin", 3/196 (rəq: 3722)

[840] "Məcmə əz-Zəvaid", 9/120

[841] İbn Həcər, "Bəzlul-Məun", səh: 117;

İbn Abdilbərr nəql etmişdir. Lakin İbn Main'dən məşhur olan hökm onun siqa olması hökmüdür. Lakin bu nəqldə bizim üçün önəmli olan Əbu Bəlc'in şiə məzhəbindən olmasıdır.

İbn Abbas'dan gəlmiş bu rəvayətin özünə gəldikdə isə İmam Əhməd'dən başlayaraq onu münkər saymış alimlər olub. Allamə Zeynuddin İbn Rəcəb – rahiməhullah – deyir: "Əbu Bəlc əl-Vasiti; Amr bin Meymun'dan, (onun vasitəsilə də) İbn Abbas'dan, o da peyğəmbərdən – salləllahu aleyhi va səlləm – hədislər rəvayət edir. Onlardan biri də Əlinin fəziləti haqqında uzun bir hədisdir ki, əl-Əsram'ın rəvayətinə əsasən onu İmam Əhməd inkar etmişdir. Ondan soruşdular: "Amr bin Meymun məgər İbn Abbas'dan rəvayət edirmi?" Dedi: "Bilmirəm, onu bilmirəm."[842] Beləliklə də buradan öyrənirik ki, İmam Əhməd bu hədisi Əbu Bəlc'in münkər xəbərlərindən biri hesab etmişdir. İmam Əhməd'in "bilmirəm" sözü o rəvayətin münkər olması mənasını daşıyır. Həmçinin əz-Zəhəbi onun münkər xəbərlərini sayarkən deyir: "Münkərlərindən biri də Amr bin Məymun'dan, onun da İbn Abbas'dan rəvayət etdiyidir ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – Əlinin – radiyallahu anhu – qapısından başqa digər qapıları bağlamağı əmr etdi."[843] Bu, uzun hədisdən sadəcə bir ləfzdir. İmam ət-Tirmizi də "əs-Sünən" kitabında deyir: "Muhəmməd bin Humeyd ər-Razi bizə rəvayət etdi; dedi: "İbrahim bin Muxtər bizə Şu'bədən, o da Əbi Bəlc'dən, o isə Amr bin Məymun'dan, o da İbn Abbas'dan rəvayət edir ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – "Əlinin qapısından başqa digər qapıları bağlamağı əmr etdi." Bu hədis ğaribdir, bunu Şu'bədən bu isnad ilə yalnız bu vəchdən bilirik."[844] Diqqət edərsək görərik ki, ət-Tirmizi hədisin həsən olduğunu söyləməmişdir, sadəcə "ğarib" olduğunu söyləməklə kifayətlənmişdir. Məlumdur ki, ət-Tirmizi yalnız "ğarib" deyərsə bununla zəif olduğunu qəsd edir. Bu isnadda isə Əbu Bəlc'dən başqa bütün ravilər şübhəsiz siqadır.

Bəzi alimlərimiz bu münkərliyin səbəbini izah ediblər. İbn Rəcəb deyir: "Hafiz Abdulğani bin Said əl-Misri zikr edir ki, Əbu Bəlc bu Amr bin Məymun'un adında xəta etmişdir, əslində o, məşhur Amr bin Məymun deyildir, o sadəcə Abdurrahmən bin Səmura'nın azadlı köləsi Məymun Əbu Abdilləhdir." Bu uzaq bir ehtimal deyildir. Doğrusunu

[842] İbn Rəcəb, "Şərh İləl ət-Tirmizi", 2/821;

[843] əz-Zəhəbi, "Mizənul-İtidəl", 4/384;

[844] "Sunən ət-Tirmizi", 6/301 (4065) ər-Risələ çapı.

Allah bilir."[845] Hafiz Abdulğani isə əd-Dəraqutni'nin müasirlərindən, Misir diyarının zamanındakı böyük mühəddislərindən Əbu Muhəmməd əl-Əzdi'dir. Onun bu təxminində nə qədər haqlı olub olmamasından asılı olmayaraq görürük ki, Əbu Bəlc'in bu rəvayətinin münkər olmasını təsdiqləmişdir. Lakin bu təxminə gəldikdə isə, yəni Əbu Bəlc'in xəta etməsi ehtimalına gəldikdə isə bunu gücləndirən tərəflər mövcuddur, belə ki, həqiqətən də bu hədisin müxtəlif hissələrini Məymun Əbu Abdilləh əl-Bəsri rəvayət edib. Bu, rəvayət Əbu Bəlc'in rəvayət etdiyi yeganə münkər xəbər deyildir. Əbul-Fədl əl-İraqi "Təxric Əhədis əl-İhyə" kitabında başqa bir hədis haqqında danışarkən deyir: "Burada Cibril və Mikayıl keçmir və bu ziyadəni hədisin əslində görə bilməmişəm və sənədində Əbu Bəlc vardır, onun haqqında ixtilaf ediblər və hədis münkərdir."[846] əl-Hakim "əl-Müstədrək" kitabında bu hədisi rəvayət etdikdən sonra deyir: "Bu, isnadı səhih bir hədisdir." Lakin Şeyx Muqbil bin Hədi əl-Vadi'i onun bu sözlərinə etiraz edərək deyir: "Xeyr, Əbu Bəlc Yəhyə bin Suleym'dir və ona İbn Əbi Suleym də deyilir. Üzərində ixtilaf edilib. Üstün rəy budur ki, zəifdir, çünki haqqındakı cərh müfəssərdir. əl-Buxari deyib: "Onda nəzər vardır." Bu isə əl-Buxari'nin istifadə etdiyi ən pis cərh sözlərindəndir."[847] Həmçinin Şeyx Şueyb əl-Arnavut "əl-Müsnəd" kitabındakı hədisin təhqiqində deyir: "(Rəvayətin) bu məzmun ilə isnadı zəifdir, Əbu Bəlci – və onun adı Yəhyə bin Süleym və ya İbn Əbi Süleym'dir – birdən çox (imam) siqa saysa da onun haqqında əl-Buxari demişdir: "Onda nəzər vardır." Onun haqqındakı ən adil görüş isə İbn Hibban'ın "əl-Məcruhin" kitabında dediyi kimi tək başına rəvayət etmədiklərində rəvayəti məqbuldur. Hədisinin mətnində münkər ləfzlər vardır, hətta "əs-Sahih"dəkilərə tamamilə zidd olduğu üçün batildir."[848]

Aydın olur ki, bu şəkildə məşhur hədislərin şiə ravilərindən gələn fərqli variantları etibarsızdır, çünki bu xəbərlər - yəni ğadir və mənzilə kimi xəbərlər - mütəvatir ləfzlərlə sabit olubsa o ləfzlərə müxalif olmaq özlüyündə rəvayətin xəta olduğunu isbat edir. Bizim burada təqdim etdiyimiz məlumatlar sadəcə olaraq bu cür variant fərqliliyinin ortaya çıxmasının ravinin məzhəbindən və etiqadından asılı olduğunu göstərir. Bizim alimlərimiz buna diqqət çəkiblər. Şeyx Abdurrahmən əl-Mubərakfuri bu ləfzdə gəlmiş hədisin şərhində buyurur: "Şiələr Əlinin

---

[845] İbn Rəcəb, "Şərh İləl ət-Tirmizi", 2/821;

[846] əl-İraqi, "Təxric Əhədis əl-İhyə", səh: 1164

[847] "əl-Mustədrak aləs-Sahiheyn", 3/155; Dar əl-Harameyn

[848] "Musnəd Əhməd", 5/181;

– radiyallahu anhu – Allahın elçisindən – salləllahu aleyhi va səlləm – sonra heç bir fasilə olmadan xəlifə olmasına dair bunu dəlil gətirirlər. Bunu buna dair dəlil gətirmələri batildir, çünki bu dəlilin doğruluğu (hədisdəki) "məndən sonra" ləfzinin səhihliyinə və onun səhih, məhfuz və hüccət kimi yararlı olmasına dayanır. Bu isə heç də elə deyildir, çünki bunu Cəfər bin Süleyman tək başına rəvayət edir və o, şiədir, hətta şiəlikdə həddini aşır.... Onun bu hədisdə "məndən sonra" sözünün şiəlik etiqadını dəstəkləməsi aşkar görünür və öz məqamında isbat olunub ki, bidətçi öz bidətini gücləndirən bir şey rəvayət edərsə rədd olunur. Şeyx Abdulhəqq əd-Dihləvi müqəddiməsində deyir: "Seçilməyə layiq olan görüş budur ki, əgər bidətinə dəvət edən, onu yayan biridirsə rədd olunur, əgər belə deyilsə qəbul olunar, amma bidətini gücləndirən bir şey rəvayət etməsi istisnadır ki, o, qəti olaraq rədd olunur." Əgər desən ki, "məndən sonra" sözünü rəvayət etməkdə Cəfər bin Süleyman tək qalmayıb, əksinə bu sözü rəvayət etməkdə ona Əcləh əl-Kindi də tabe olub... Deyərəm ki, bu Əcləh əl-Kindi də həmçinin şiədir...Aşkar görünən budur ki, "məndən sonra" sözü bu iki şiənin xətasından qaynaqlanır və bunu dəstəkləyən tərəf budur ki, İmam Əhməd müsnədində bu hədisi bir neçə yoldan rəvayət edib və onlardan heç birində bu əlavə sözlər yoxdur..."[849]

Şiə alimlərinin bu mövzuda gətirdikləri bəzi xəbərlər vardır ki, onları əhlüs-sünnət kitablarına nisbət edirlər. Həqiqətdə isə bu rəvayətlərin nisbəti ya tamamilə yalandır, ya da sünnət əhli nəzərində heç bir etibarı olmayan kitablarda keçir. Misal üçün şiə alimi Muhəmməd Cəfər Mədarşəriət yazır: "(Aşkar dəlillər)dən biri də Əhməd bin Hənbələ nisbət olunan rəvayətdir ki, Müsnədində peyğəmbərdən – salləllahu aleyhi va əlihi və səlləm – belə dediyini rəvayət edib: "Adəm yaradılmadan on dörd min il əvvəl mən və Əli bin Əbi Talib Allahın qarşısında bir nur idik. Allah Adəmi yaratdığında o nuru onun sülbünə yerləşdirdi, və Abdulmuttalibə qədər bir nur olaraq qaldıq, ondan sonra ayrıldıq; mənə peyğəmbərlik, ona xəlifəlik düşdü."[850] Şiə aliminin rəvayəti gətirmək tərzindən bilinir ki, özü də bu rəvayətin "əl-Müsnəd" kitabında olmadığını bilir və həqiqətən bu xəbər İmam Əhmədin kitabında yoxdur. Bu rəvayəti biz İbnul-Məğazili'nin "əl-Mənaqib" kitabında tapırıq.[851] Hədisin ravilərindən biri

[849] əl-Mubərakfuri, "Tuhfətul-Əhvazi", 10/146-147;

[850] Şəriətmədar, "əl-Bərahin əl-Qatia", 3/242; Mərkəz əl-Ulum vas-Səqafə əl-İsləmiyyə, Qum, 1424

[851] İbnul-Məğazili, "Mənaqib Əmir əl-Muminin Əli bin Əbi Talib", rəq: 130;

əl-Həsən bin Əli bin Zəkəriyya'dır. İbn Adiyy onun haqqında deyir: "əl-Həsən ibn Əli ibn Salih, Əbu Səid əl-Adəvi əl-Bəsri — hədis uyduran biri idi. O, Xiraş yolu ilə Ənəs ibn Malikdən on dörd hədis rəvayət etmişdir. O, kim olduqları bilinməyən adamlar adından da hədislər nəql etmiş, etibarlı ravilərdən isə batil xəbərlər rəvayət etmişdir."[852] İbn Hibban deyir: "**əl-Həsən ibn Əli ibn Zəkəriyyə, Əbu Səid əl-Adəvi** — Bəsrəli idi, Bağdadda məskunlaşmışdı. Görmədiyi şeyxlərdən rəvayət edir, gördüyü şəxslərin adından isə hədis uydururdu. O, bizim dövrümüzdə Bağdadda sağ idi və yaşayırdı. Onun etibarlılığını yoxlamaq üçün ondan hədis eşitmək istədim və bunun üçün onun hədislərindən bir cüz götürdüm. Gördüm ki, o, Əbu Rəbiə əz-Zəhrani və Məhəmməd ibn Əbdul-Alə əs-Sən'ani'dən belə rəvayət edir: hər ikisi dedi: "Bizə Abdurrazzaq rəvayət etdi, dedi: Ma'mər bizə əz-Zuhri'dən, o da Urvədən, o da Aişədən, o isə Əbu Bəkr əs-Siddiqdən xəbər verdi; dedi: Allaın Rəsulu — salləllahu aleyhi və səlləm — buyurdu: '**Əlinin — aleyhissəlam — üzünə baxmaq ibadətdir.**'" Bu isə elə bir şeydir ki, hədis əhlinin arasında sıradan kimsələr belə bunun uydurma olduğuna şəkk etməz. Əs-Siddiq belə bir xəbəri əsla rəvayət etməmişdir, nə də əs-Siddiqa onu rəvayət etmişdir, nə də Urvə bunu nəql etmişdir, nə də əz-Zühri belə bir şeyi zikr etmişdir, nə də Ma'mər belə bir söz söyləmişdir. Belə bir şeyi əz-Zəhrani və əs-Sən'ani kimi bəsirət əhlinin mahir mütəxəssislərinin adından uyduran bir adamın rəvayətləri rədd olunmağa və tərk edilməyə tam şəkildə layiqdir. Əhməd ibn Abdə əd-Dəbbi'dən, o da İbn Uyeynədən, o da Əbu Zubeyrdən, o isə Cabirdən rəvayət etdi: dedi: "Allahın elçisi – salləllahu aleyhi və səlləm – bizə övladlarımızı Əli ibn Əbi Talib'in sevgisinə ərz etməyimizi əmr etdi." Bu da batildir. Allah Rəsulu – salləllahu aleyhi və səlləm – belə bir şeyi heç vaxt əmr etməmişdir, nə də Cabir bunu söyləmişdir, nə də Əbu Zubeyr bunu rəvayət etmişdir, nə də İbn Uyeynə bunu nəql etmişdir, nə də Əhməd ibn Abdə bu isnadla belə bir şeyi zikr etmişdir. Bu xəbəri eşidən bir kimsə bunun uydurma olduğuna şəkk etməz. Buna görə də mən o şeyxin yanına getmədim və ondan heç bir şey eşitmədim. Sonra onun rəvayət etdiyi şeyləri bir-bir tapıb topladım və gördüm ki, o, etibarlı ravilərin adından - məqlub xəbərlərdən əlavə - mindən çox uydurma xəbər rəvayət edib. Sözü uzatmaqdan xoşlanmadığım üçün ətraflı danışmıram."[853] Üstəlik bunu əl-Həsən bin Əli'dən rəvayət edən şəxs imamiyyə şiələrinin

[852] İbn Həcər, "Lisənul-Mizən", 3/81; Darul-Bəşəir əl-İsləmiyyə, 2002

[853] İbn Hibban, "əl-Məcruhin", 1/292-293 (223);

alimlərindən olan Əli bin Muhəmməd əl-Adəvi əş-Şimşəti'dir. ət-Tehrani onu şiə alimləri üçün yazdığı "Tabəqat" kitabında zikr edir və deyir ki, "İbn Tavus onu "Fərcul-Məhmum" kitabında əshabımızdan olan münəccim alimlər arasında sayıb."[854] İbnul-Məğazili bundan sonra daha bir rəvayət zikr edir və orada Cabir bin Abdilləh'in Peyğəmbərdən - aleyhissalətu vassələm - belə dediyi rəvayət olunur: "Həqiqətən Allah - azzə va cəllə - bir nur parçasını nazil etdi və onu Adəmin sülbündə yerləşdirdi. Onu iki hissəyə ayırana qədər (övladlarında) daşıdı; bir hissəsi Abdullahın sülbündə, o biri hissəsi isə Əbu Talibin sülbündə yerləşdi. Məni bir peyğəmbər olaraq çıxardı və Əlini bir vasi olaraq çıxardı."[855]" Bu rəvayətin isnadında Əhməd bin Əli əl-Qavariri əl-Vasiti və Əbu Abdilləh Muhəmməd bin Əli ibn Uxti Mehdi əs-Səqati əl-Vasiti kimi məchul ravilər yer alır. əl-Qavariri bunu Muhəmməd bin Abdilləh bin Sabit'dən rəvayət edir və belə görünür ki, o, Muhəmməd bin Abdilləh bin İbrahim bin Sabit əl-Uşnəni'dir. əd-Dəraqutni yazır ki, o, "bir yalançı və dəccaldır, hədis uydurur."[856] Bu təbaqatda Muhəmməd bin Abdilləh bin Sabit adında başqa ravi yoxdur.

Etdiyimiz bu müzakirənin sonunda bizə bir şey aydın olur. Əhlüs-sünnət kitablarında imamətə dəlalət edəcək səhih və sarih heç bir dəlil yoxdur. Bu dəlillərin içində dəlaləti ən güclü olanlar da əslində şiə ravilərin rəvayəti ilə sünnət əhlinin kitablarına keçib. Bu reallığı hələ zamanında əş-Şərif əl-Murtəda görüb və etiraf edib. O, imamətə dəlalət edən rəvayətləri yeni bir bölgü ilə bölərkən deyir: "Sonra, söz ilə (imamın təyini barəsindəki) nass – daha bir təqsim ilə iki növə bölünür: Birinci növ (o növdür ki, on)u xüsusilə imamiyyə şiələrindən başlaları nəql etməyiblər. Bəzən, bu məzmunda olan xəbərlərin bəzisini, onun mahiyyətinə diqqət yetirməyən bəzi hədis əhli də rəvayət etmişdir. Bu növ nass **"cəli"** (açıq-aşkar, bəlli) adı ilə tanınır. İkinci növ isə – şiə və nasibi tərəfindən rəvayət olunmuş nasdır ki, ümmətin hamısı onu – aralarındakı ixtilafa baxmayaraq – qəbul etmiş və onlardan elə bir kimsə bunu inkar etməmişdir ki, onun inkarına dəyər verilsin və ya onun kimi biri(nin inkarı) fikir ayrılığı sayılsın. Lakin bu növ nassın təvili barəsində ixtilafa düşmüş, onunla nə nəzərdə tutulduğu məsələsində fikir ayrılığına varmışlar. Bu isə bizim ikinci olaraq qeyd etdiyimiz **"xəfi"** (üstüörtülü, gizli) nasdır."[857] Bir başqa kitabında əş-Şərif əl-

---

[854] ət-Tehrani, "Tabəqat Aləmiş-Şiə", 1/202;

[855] İbnul-Məğazili, "Mənaqib Əmir əl-Muminin Əli bin Əbi Talib", rəq: 132;

[856] əz-Zəhəbi, "əl-Muğni fid-Duafə", 2/601 (5702);

[857] əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İmamə", 2/67-68; əd-Dirayəti'nin təhqiqində 2/315;

Murtəda müxaliflərin onlara qarşı gətirdikləri etirazı zikr edir ki, “əgər nass haqq olsaydı, onun gizli qalması qeyri-mümkün olardı. O halda bu nass (təyinat) barəsində elm, ümumi vacib hökmlər barəsindəki elm kimi aşkar və məlum olmalı idi.” Bunun cavabında buyurur ki, “bu tənqid nassın dəlilləri içərisində yalnız bizim qeyd etdiyimiz axırıncı metoda layiq ola bilər və bu, şiələrin nəql etdikləri və cəli (açıq-aşkar) nass adlandırdıqlarıdır.”[858] Yəni əş-Şərif əl-Murtəda təsdiq edir ki, bu deyilən etiraz Ğadir və Mənzilə kimi sünnət əhlinin kitablarında gəlmiş rəvayətlər haqqında keçərlidir, yalnız onların dəlaləti gizlidir. Amma imamiyyə şiələrinin kitablarında keçən rəvayətlərə gəldikdə isə onların dəlaləti aşkardır. Lakin qeyd etdiyimiz kimi imamiyyə şiələrinin kitablarında keçən rəvayətlər onların müxalifləri üçün hüccət deyildir. Yalnız imamiyyə kitablarında keçən rəvayətlər barəsində zeydi alimlərindən əl-Mənsur Billəh Abdullah bin Həmzə (h. 561-614) yazır: “İmami şiələrin təkbaşına rəvayət etdiyi xəbərlərin mütəvatir həddinə çatmaqlarına, zəruri elm hasil olmasına hökm etmək bir kənarda qalsın, ümmət onları ümumiyyətlə heç səhih saymır. Çünki biz bilirik ki, imami şiələrinin nümayəndələri, alimləri və onların söz sahibləri "Ğədir" hədisi, "Mənzilət" hədisi və rukuda zəkat vermə ayəsi ilə dəlil gətirərkən bizim metodumuzu tətbiq edirlər və bu məsələ onların əsərlərində və kitablarında məlumdur. Onlar bu xəbərləri araşdırarkən və izah edərkən var qüvvələri ilə çalışaraq maksimum dərəcədə aydınlaşdırma və isbat etməyə çalışırlar. Əgər bu xəbərlərin mənası, onların iddia etdiyi kimi, onlar üçün zəruri şəkildə məlum olsaydı, əsas dini prinsiplərdə etdiyimiz kimi əlavə araşdırma və açıqlamaya ehtiyac duymazdılar. Məsələn, biz müsəlmanlara namazların beş vaxt olduğunu, maldan zəkat verilməsinin vacib olduğunu, Allah evini ziyarət üçün həccin vacib olduğunu və bu ümmətin peyğəmbərinin Muhəmməd – salləllahu aleyhi və alih – olduğunu isbat etmək üçün ayrıca dəlil göstərmirik. Çünki bu məsələlər zəruri olaraq məlum olduğundan, hər hansı açıqlamaya və ya sübuta ehtiyac yoxdur; sadəcə İslam dininə bağlı olduğunu göstərən şəxsə əməli ilə qiymət veririk. əş-Şərif əl-Murtəda əl-Musəvi kimi onların görkəmli alimlərinin və ondan əvvəl və sonra gələn digər mütəkəllim alimlərinin – bu ayə və hədislərin mənalarını izah etməkdə həddindən artıq dərəcədə səy göstərdiklərindən anlayırıq ki, onlar zəruri elm iddiasında uçurumun kənarında durublar. Çünki aydın olanı aydınlığa qovuşdurmağa çalışmaq mənasız bir işdir; aşkar və məlum olanı isbat etmək üçün niyə

[858] əş-Şərif əl-Murtəda, “Cəvab əl-Məsəil ət-Tarablusiyyə”, 1/132-144;

bu qədər əziyyət çəkirlər? Necə ola bilər ki, açıq şəkildə müşahidə edilən bir şeyi təkrar izah edib, açıqlamağa çalışırlar? Digər tərəfdən, biz və onlar, sayı-hesabı mümkün olmayan çox böyük bir topluluq olaraq, Peyğəmbərdən – salləllahu aleyhi və alih va səlləm – sonra dərhal xəlifənin möminlərin əmiri Əli ibn Əbu Talib olduğunu və ondan öncə gələnlərin xəta etməklə və asi olmaqları məsələsində həmfikir olduğumuz halda, niyə zəruri bilik hamımıza və ya heç olmasa bir qismimizə çatmamışdır? Əgər onların iddia etdikləri bu nass, zəruri biliyə səbəb olsaydı, bu bilik həm bizə, həm də onlara çatardı. Çünki dəlilin nə olduğu və necə istifadə edilməsi mövzusunda onlar və biz həmfikirik. Əgər onlara zəruri elm hasil olsaydı, bizə də hasil olmalı idi. Necə ki, müşahidə edənlərin bəzilərinin gördüyünü iddia edib digərlərinin görmədiyini iddia etməsi mümkün deyil, burada da eyni vəziyyət mövcuddur. Həmçinin, mütəvatir xəbərləri eşidənlərin bəzilərinə zəruri elm hasil olub digərlərinə hasil olmaması necə mümkünsüzdürsə, burada da vəziyyət eyni cürdür."[859] Bu sözlər bizim bu bölmədə təqdim etdiklərimizi təsdiqləyir.

## Şiələrdə mütəvatir yoxdur

Burada onu da qeyd etməliyik ki, imami şiələrin kitablarında imamlara dair gəlmiş xəbərlərin heç biri mütəvatir deyildir. Bunu şiə alimləri arasında ən parlaq ulduzlardan hesab olunan əl-Mufid etiraf edir. O yazır: "Xilaf əhlindən kimsə desə ki, imamilərin rəvayət etdikləri naslar uydurmadır və bununla bağlı gəlmiş xəbərlər əhəddir, əgər elə deyilsə bizə rəvayət yollarını zikr edin, onların səhihliyindən şəkki və şübhəni aradan qaldıracaq dəlili göstərin! Onlara deyilər: Vəsf etdiyimiz imami məzhəbində imamlara – aleyhimussələm – dair nass xəbərlərinin mütəvatir olmaması imami məzhəbinə zərər verməz, xəbərlərin əhəd olması onların xeyrinə hüccət olmaqlarına mane olmaz, çünki onları, imamlığın vacibliyi, imamların sifətləri

[859] əl-Mənsur Billəh, "əl-Aqd əs-Səmin fi Əhkəm əl-Əimmətil-Hədin", səh: 50-52; Muəssəsətu əl-İməm Zeyd bin Əli əs-Səqafiyyə, Amman, 1421

barəsində qeyd etdiyimiz və şərh etdiyimiz əqli dəlillər dəstəkləyir…”[860] Burada əl-Mufid'in sözünün mənası budur ki, xəbərlər mütəvatir olmasa da ümumilikdə imamların olmasının zəruriliyinə dair əqli dəlillər mövcuddur; bu əqli dəlillər - iddiaya görə - imamların mövcud olmasını, onların müəyyən vəsflərə sahib olmaqlarını zəruri edir, ona görə də o imamlara dair nasların mütəvatir olmaması zərər verməz, əksinə dəlalət baxımından ən yaxşı dəlillər olması kifayət etməlidir. əl-Mufid burada əqli dəlil dedikdə “lütf burhanı” kimi əqli dəlilləri qəsd edir. Lakin, əziz oxucu, bu kitabımızda həmin lütf dəlilinin tutarsızlığını kifayət qədər izah etmişik və o dəlilin tutarlılıq dərəcəsi üçün müvafiq bölməni oxumağı tövsiyə edirik.

Həmçinin əş-Şərif əl-Murtəda da bu mənanı təsdiqləyir. İlk əvvəl əl-Qadi Abdulcəbbar'ın etirazını gətirir və daha sonra buna cavab verməyə çalışır. Deyir: “(Abdulcabbar dedi: ) “Biz həmçinin izah etdik ki, imamı isbat etmək mütəvatir xəbərin olduğunu isbat etmədən keçərli deyildir, beləliklə də imamın mövcudluğu, mütəvatir xəbərlərin doğruluğundan asılıdır və mütəvatir iddiası batil olduqda imaməti isbat etmək də səhih ola bilməz.” Bundan sonra əş-Şərif əl-Murtəda cavab verir və deyir: “Məsələ heç də onun təvəhhüm etdiyi kimi deyildir, çünki bizə görə imamları ümumilikdə isbat etməyin, onların hər əsrdə mövcud olmaqlarının vacibliyini isbat etməyin dəlili mütəvatir xəbər deyildir; əksinə bunun dəlili əql və əqli dəlillərdir. Mütəvatir xəbər bizdə yalnızca hər bir imamın kimliyini, yəni imamın o yox, məhz bu olduğunu müəyyən olaraq isbat etmək üçün bir yoldur…”[861] Bundan sonra əş-Şərif, imamların ayrı-ayrılıqda kim olduğunu müəyyən etməyin yollarından birinin də möcüzə olduğunu əlavə edir. Belə anlaşılır ki, ümumilikdə imamət konseptini isbat etmək üçün və imamların mövcudluğunun zəruriliyini göstərmək üçün mütəvatir xəbərin olması şərt deyildir; bu barədə nə Quranda dəlilin olması, nə də mütəvatir xəbərlərin olması labüd deyildir, çünki - əş-Şərif əl-Murtəda'ya görə - bunun isbatı əqli dəlillərlə baş verir. Həmçinin Şeyxut-Taifə ət-Tusi bu sözlərin təlxisində yazır: “Şiələrin hamısı və mötəzilədən çox alim dedi ki, (imamətin) vacib olma yolu əqldir, onun vacibliyi nəqldən aslı deyildir.”[862] Başqa bir yerdə ət-Tusi maraqlı bir etiraza yer verir. Etiraz edən qeyd edir ki, beş vaxt namazın vacibliyi, orucun, zəkatın və həccin vacibliyi haqqında gəlmiş xəbərlər o qədər

[860] əl-Mufid, “əl-Məsəil əl-Cərudiyyə”, səh: 46-47;

[861] “əş-Şəfi fil-İmamə”, 1/100;

[862] “Təlxis əş-Şəfi”, 1/65;

çox yoldan gəlib ki, bizə şəkkə yer buraxmayacaq dərəcədə elm verir. Bəs nə üçün imamlıq haqqında bu cür bir elm yoxdur? ət-Tusi deyir: "Sizin zikr etdiyiniz bu işlər haqqında elm, sizin dediyiniz şəkildə, yəni fəqət onlarla bağlı nass gəldiyinə görə hasil olmayıb, əksinə onlar haqqında elm ona görə hasil olub ki, 1) çünki onlarla bağlı nass böyük bir kütlənin hüzurunda deyilib, 2) üstəlik onlarla əməl olunub və 3) bu barədəki xəbərləri gizlətməyə heç bir ehtiyac olmayıb, 4) əksinə bu xəbərləri nəşr etmək üçün ehtiyac olub, çünki İslam dini yalnız bununla ayaqda dura bilər. Bütün bunlar (imamla bağlı) naslarda mövcud deyildir, çünki…" Bundan sonra ət-Tusi qeyd edir ki, imamət nassı böyük bir kütlə qarşısında deyilməyib, üstəlik bu nassın yayılmasının qarşısını almaq istəyi ortaya çıxıb, beləliklə də bu xəbərlərlə bağlı elm yolu qətiliyini itirib.[863] Belə anlaşılır ki, ət-Tusi imamətlə bağlı dəlillərin mütəvatirlik və qətiyyət baxımından namaz, oruc kimi əməllər haqqında gəlmiş dəlillərdən zəif olduğunu etiraf edir. Halbuki imamət məsələsi imami şiələrinə görə namazdan, orucdan, zəkat və həcdən də üstün və əzəmətli ibadətdir. Bu məsələnin dəlillərinin sözü gedən məsələlərin dəlilləri qədər yayğın, aşkar və birmənalı olmamağını ət-Tusi bəzi səbəblərlə izah etməyə çalışır. Gördüyümüz kimi birinci səbəb olaraq imamət məsələsinin geniş kütlələrin hüzurunda zikr olunmadığını söyləyir. Burada təbii ki, sünnət əhli belə bir sual verməlidir; əgər imamət mövzusu namaz kimi ibadətlərdən də daha əzəmətli və əhəmiyyətlidirsə nə üçün daha böyük bir kütlənin hüzurunda bu təlimlər öyrədilməyib?! İkinci səbəb olaraq ortaya atdığı iddia bu oldu ki, imamət fikrinin, xüsusilə də Əlinin xəlifəliyinin yayılmasının qarşısını almaqda maraqlı olan dairələr olub. ət-Tusi aradakı fərqlərdən birini bunda görür; namaz kimi bir ibadəti hamı qəbul edirdi, hamı namaz haqqındakı xəbərləri yaymaqda həvəsli idi, amma Əlinin xəlifəliyi haqqındakı xəbərləri qəbul etmək istəmədikləri üçün onları nəşr etməkdən imtina edirdilər. Belə bir əks kampaniyanın mövcud olduğunu iddia etmək üçün bunun ya dövlət dairələri tərəfindən aparıldığını, ya da xalq kütləsi tərəfindən şüurlu şəkildə edildiyini söyləmək lazımdır. O dövrdə dövlətin, insanların danışdıqları, rəvayət etdikləri üzərində kontrol etmək və senzura tətbiq etmək imkanları yox idi. Əgər imamətlə bağlı xəbərləri minlərlə səhabə eşitmişdisə onların bu xəbərləri rəvayət etməklərinə dövlət mane ola bilməzdi. Bunu göstərmək üçün xəlifələrin həyatlarından xeyli misallar vermək olar ki, orada xəlifələr müəyyən hədisin xəta olduğuna

[863] "əl-Mufsah fi İməməti Əmir əl-Muminin val-Əimmə", səh: 121-122;

inanmaqlarına baxmayaraq o hədis səhabələr tərəfindən rəvayət olunub. Fatimə bint Qeys hədisi və ya Abdullah bin Abbas'ın rəvayət etdiyi bəzi hədislər bunun misallarından bəziləridir. O zaman belə çıxır ki, bu xəbərləri rəvayət etməkdən imtina edənlər səhabələrin özləri və onların tələbələri olublar. Belə bir iddianın doğru ola bilməyəcəyini göstərən ən aşkar dəlil budur ki, Əlinin fəzilətlərini məhz həmin səhabələr rəvayət ediblər. Əgər Əliyə qarşı belə bir nifrətə və qərəzə sahib olduqları üçün onun vilayəti və xilafəti haqqındakı xəbərləri gizləyiblərsə o zaman onun fəziləti haqqında gəlmiş xəbərləri də gizlətməkləri lazım olardı.

Beləliklə də bu şiə alimlərinin sözlərindən başa düşülür ki, imamət ilə bağlı heç bir mütəvatir xəbər yoxdur. Bu şiə alimlərinin sözlərində keçən bir məsələyə də toxunmaq lazımdır. əl-Murtəda əş-Şərif etiraf edir ki, ümumilikdə imamət konseptinə dair hansısa mütəvatir xəbər mövcud deyildir, lakin hər bir imam üçün ayrı-ayrılıqda onun kimliyini müəyyən edən sübutlardan biri də mütəvatir xəbər ola bilər. Şiə alimləri özləri çox gözəl bilirlər ki, heç bir şiə imamının təyin olunması ilə bağlı mütəvatir xəbər yoxdur. Ona görə də bəziləri əş-Şərif əl-Murtəda kimi düşünən şiə alimlərinin sözlərini bütün imamlar haqqında gəlmiş xəbərlərin bir araya toplanması halına aid edirlər, yəni yalnız o zaman mütəvatir ola biləcəyini deyiblər. əş-Şəhid əs-Səni yazır: "əl-Murtəda və ona tabe olanların nassa dəlalət edən və başqa xəbərlərin mütəvatir olması ilə bağlı iddiaları da bu mənada anlaşılmalıdır; çünki şübhə yoxdur ki, o xəbərlərdən hər biri əhəd xəbərdir və (əl-Murtəda) özü ət-Təbəniyyət məsələləri kitabında buna işarə edib."[864] Buradan anlamış oluruq ki, nə ümumilikdə imamət fikrinin özü üçün, nə də ayrılıqda hansısa imamın təyinatı ilə bağlı mütəvatir xəbər mövcud deyildir. əl-Murtəda'nın iddiası budur ki, bu fərqli xəbərlərin hamısı birlikdə mütəvatir həddinə çatır. Əslində burada "mütəvatir" olaraq irəli sürülən kateqoriya alimlərin dirayət elmində qəsd etdikləri mütəvatir mənası ola bilməz. Çünki termin olaraq mütəvatir xəbər, hansısa müəyyən bir kəsdən və ya hansısa konkret hasisə ilə bağlı gələn xəbərlə bağlıdır; ayrı-ayrı şəxslər barəsində onların imam olmaqlarına dair şiə kitablarında çox sayda rəvayətlərin olması isə mütəvatirliyə dəlalət etmir. Çünki bu cür "mütəvatirlik" əslində çox sayda yalançı və ya zəif və ya qeyri-ciddi ravinin öz etiqadlarına uyğun olaraq bir-birindən fərqli, bir çox halda bir-birinə zidd gələn rəvayətlər uydurması ilə və ya iqtibas

[864] əl-Amili, "ər-Riayə fi İlm əd-Dirayə", səh: 66;

etməkləri ilə ortaya çıxır. Çünki şiə alimlərinin bu cür mütəvatirliyi bir çox mövzuda iddia etdiklərini görmüşük ki, o mövzular özlüyündə aşkar olan batil mənalar daşıyırlar. Misal üçün Quranın təhrif olması haqqında gəlmiş xəbərlərin mütəvatir olduğunu iddia edən şiə mühəddisləri çoxdur. Xoşbəxtlikdən əksər şiələr bu xəbərlərin tərkibini rədd edirlər. Şiələrin mütəvatir olduğunu iddia etdikləri imamət xəbərləri də eyni şəkildə Quranın təhrif olması ilə bağlı şiə kitablarında toplanmış xəbərlərin mütəvatirliyi kimidir. əl-Məclisi bu barədə deyir: "Bu xəbərin və (bunun kimi) çox sayda səhih xəbərlərin Quranın naqis və dəyişdirilmiş olmasına açıq-aşkar dəlalət etməsi gizli bir məsələ deyildir. Mənə görə bu mövzuda gəlmiş xəbərlər mənaca mütəvatirdir. Bunların hamısını bir kənara atmaq ümumən xəbərlərə kökündən etibar etməməyi gərəkdirir. Hətta güman edirəm ki, bu mövzudakı xəbərlər imamət xəbərlərindən geri qalmır. O zaman imaməti necə xəbərlə isbat edə bilirsiz?!"[865] Belə çıxır ki, imamət hədislərinin mənaca mütəvatir olması Quranın təhrifi haqqında gəlmiş və mənaca mütəvatir olduğu iddia olunan xəbərlər kimidir. Səlim iman sahibi bir müsəlman bilir ki, Allahın göndərdiyi Quran kitabı təhrif olunmayıb və iddia olunan bu xəbərləri isə yalançı ravilər uydurublar.

Bütün bunlar bizə dönə-dönə isbat edir ki, şiələrdə heç bir mövzuda mütəvatir xəbər yoxdur. Bunun səbəbini anlamaq o qədər də çətin deyildir. Bunu anlamaqda bizə tanınmış şiə mühəddisi və müctəhidi Əbul-Qasim əl-Xoyi kömək edəcək. O, şiələrdəki xəbərlərin mütəvatirliyini iddia edən əxbarilərin iddialarına cavab verərkən deyir: "İmamların - aleyhimussələm - əshabı hədisləri rəvayət etməkdə və onları itib getməsin deyə qorumaqda bütün səylərini ortaya qoymaqlarına və maksimum dərəcədə buna əhəmiyyət verməklərinə baxmayaraq, təqiyyə zamanında yaşadıqları üçün hədisləri aşkarda nəşr etmək imkanları olmayıb; o zaman necə ola bilər ki, bu hədislər mütəvatir həddinə çata və ya buna yaxın düşə bilib?!"[866] Həqiqətən də bu çox önəmli bir nöqtədir, çünki şiələrin imamlar haqqında təqiyyə zərurətini iddia etmələri ilə yanaşı onlardan hansısa xəbərin mütəvatir olduğunu iddia etmələri ziddiyyətlidir. Yalnız ictimaiyyətə açıq dərslər və xütbələr verən şəxslərin sözləri ləfzən mütəvatir ola bilər, əks təqdirdə bunun mütəvatir olması imkansızdır. Ona görə də biz Allahın elçisindən - aleyhissalətu vassələm - mütəvatir gəlmiş xəbərlərin Arafada, Ğadir Xumda və buna bənzər yerlərdə çox sayda insanın

---

[865] əl-Məclisi, "Mirətul-Uqul", 12/525;

[866] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 1/22;

qarşısında demiş olduğu sözlərdən ibarət olduğunu görürük. Həmçinin Əli bin Əbi Talib'dən - kərraməllahu vachəhuh - mütəvatir olmuş xəbərlərin də eyni şəkildə ictimaiyyət qarşısında - misal üçün Kufə məscidində xütbə verərkən - dedikləri sözlərdən ibarət olduğuna şahid oluruq.

Qeyd etməyimiz lazımdır ki, heç bir imamın imamlığı barəsində şiə kitablarında mütəvatir xəbər yoxdur. Ümumiyyətlə on iki imam haqqında mütəvatir xəbər yoxdur və biz bu kitabımızda bu barədə xüsusi bir bölmə açmışıq. Amma şiə kitablarında yayğınlaşmış və məşhurlaşmış xəbərlər var ki, şiə alimləri bunu "mütəvatir xəbərlər" olaraq təqdim edirlər, lakin bu xəbərlərin mütəvatir ilə yaxından-uzaqdan heç bir əlaqəsi yoxdur. Burada oxucunun diqqətini İmam Əbu Həmid əl-Ğazzəli'nin sözlərini çatdırmaq istəyirik: "Belə isə, bu (xəbər) mütəvatirlik şərtinə uyğun gəlirmi, ya yox? Çünki bəzən insanlar məşhur (müstəfiz) xəbəri mütəvatir zənn edə bilərlər. Halbuki mütəvatirin həddi elə bir həddir ki, onda şübhə təsəvvür edilə bilməz. Peyğəmbərlərin mövcudluğu, məşhur şəhərlərin varlığı və bu kimi şeylər buna misaldır. Mütəvatir xəbər bütün əsrlərdə, bir əsrin ardınca növbəti əsrdə, ta nübüvvət zamanına çatana qədər mütəvatir olmalıdır. Məgər təsəvvür edilə bilərmi ki, əsrlərdən hansısa birində mütəvatirlik üçün lazım olan rəvayətçi sayı azalmış olsun? Quranda olduğu kimi belə bir şeyin baş verməməsi mütəvatirliyin şərtlərindən biridir. Amma Qurandan başqa xəbərlərdə isə bu məsələnin idraki çox çətinləşir və bunu idrak etmək tarixi kitabları, əvvəlki əsrlərin hallarını, hədis kitablarını və ravilərin vəziyyətlərini, bununla yanaşı onların sözləri nəql etməkdəki niyyətlərini araşdıranların işi ola bilər. Çünki hər əsrdə mütəvatir sayını təşkil edən qədər rəvayətçi olsa da, buna baxmayaraq, bu məlumatla qəti elm hasil olmaya bilir, çünki çoxsaylı böyük bir kütlənin arasında - xüsusilə də məzhəblər arasında təəssübkeşlik meydana gəldikdən sonra - təvafüq (qarşılıqlı etiqad uyğunluğu) əlaqəsinin olduğu təsəvvür edilə bilir. Buna görə də görürsən ki, **rafizilər** Əli ibn Əbi Talib'in – radiyallahu anhu – imamlığı barəsində nassın mövcud olduğunu iddia edirlər; çünki bu, onların nəzərində mütəvatir sayılır. Halbuki onların müxalifləri isə başqa bir çox məsələlərdə, onların nəzərində mütəvatir olan şeylərin əksinə, özlərinə görə mütəvatir hesab etdikləri şeylərə istinad edirlər. Çünki rafizilər

yalanlarını yaymaqda və ona tabe olmaqda öz aralarında şiddətli təvafüq içindədirlər."[867]

## Nassın olmadığına dair əqli və vaqii dəlillər

Tarixi hadisələrə nəzər saldığımızda və onu sarih əqli analizə tabe tutduğumuzda görürük ki, iddia olunan imamət inancının reallıqda heç bir əsası yoxdur. Çünki istər Peyğəmbərimizin - salləllahu aleyhi va səlləm - sağlığında, istərsə də ölümündən sonra cərəyan etmiş hadisələr belə bir təsəvvürə yer buraxmır. Başqa sözlə desək təyin olunmuş bir imam olsaydı Allahın elçisinin - aleyhissalətu vassələm - və onun əhlul-beyti də daxil olmaqla ən yaxın həvarilərinin tamamilə fərqli tarixi izləri olmalı idi. Bunun belə olmaması imamət inancı ilə heç bir şəkildə uyğun gəlmir. Bunu nümayiş etdirmək üçün tarixi vaqiələrindən bəzilərinə müraciət edəcəyik.

Peyğəmbər – aleyhissalətu vassələm – vəfat etdikdə səhabələrin arasında şiddətli bir hüzn, şok və dəhşət var idi. Bu şok və dəhşətin təsiri ilə səhabələr bir neçə böhranlı vəziyyətdən keçməli oldular. Bunlardan birincisi peyğəmbərin - aleyhissalətu vassələm - ölüm xəbərinə reaksiya idi. Beləki Ömər bin əl-Xattab peyğəmbərin – salləllahu aleyhi va səlləm – ölüm xəbərini qəbul etməmişdi. O, Aişənin evinə daxil olduqda və Allah rasulunun üzünü açdıqda onun sadəcə olaraq ürəkdən getdiyini düşündü.[868] Üstəlik Ömər - "bələliklə də sizi insanlara şahid olasınız və peyğəmbər də sizə şahid olsun deyə orta bir ümmət etdik" - ayəsinə əsaslanaraq inanırdı ki, peyğəmbər ümmətin son əməllərini görənədək, münafiqləri təmizləyənə qədər vəfat etməyəcək. Bu böhranı həll etmək üçün irəli çıxıb xütbə verən Əbu Bəkr oldu. Ömər insanlara xitab edib danışarkən Əbu Bəkr ona oturmasını buyurur; Ömər imtina edir və Əbu Bəkr ondan bir daha oturmasını tələb edir. Ömərin yenə imtina etdiyini gördükdə birbaşa

---

[867] əl-Ğazəli, "Feysal ət-Təfriqa", səh: 18;

[868] "Musnəd Əhməd", 43/34-36 (25841);

insanlara xitab edərək şəhadət gətirir və danışır, insanların diqqətini özünə çəkir. Xütbəsində məşhurlaşmış o sözlərini deyir: "Kim Muhəmmədə ibadət edirdisə bilsin ki, Muhəmməd ölüb, kim Allaha ibadət edirdisə Allah həmişə diridir, heç zaman ölməz."[869] Əgər peyğəmbər – aleyhissalətu vassələm – özündən sonra xəlifənin Əli olmasını bəyan etmişdisə bu məqamda Əlinin qabağı keçməsi və öz vəzifəsini yerinə yetirməsi lazım idi. Halbuki gördüyümüz budur ki, həmin böhranda müsəlmanları sakitləşdirən, onların yarasına məlhəm sürən birinə ehtiyac olduğu halda Əli bin Əbi Talib - kərraməllahu vachəhu - özünü qabağı verib müsəlmanlara heç bir tövsiyə etmədi. Məlumdur ki, imamət - xüsusilə də şiələrin etiqad etdiyi imamət - bir imtiyazdan daha çox ağır bir vəzifədir və Əli - kərraməllahu vachəhu - özünü imam görsəydi heç zaman bu vəzifəsində ehmalkar davranmazdı.

Daha bir misal Səqifə hadisəsidir. Rəvayət olunur ki, Allahın elçisinin - aleyhissalətu vassələm - vəfatından sonra "ənsar "Səqifətu Bəni Saidə" adlanan yerdə Sə'd ibn Ubada ətrafında toplandılar və dedilər: "Bizdən bir əmir, sizdən də bir əmir olsun." Bunun üzərinə Əbu Bəkr, Ömər ibn əl-Xəttab və Əbu Ubeydə ibn əl-Cərrah onların yanına getdilər. Ömər danışmaq istədi, lakin Əbu Bəkr onu susdurdu. (Ömər sonralar deyərdi:) "Allaha and olsun, mənim bu davranışımın məqsədi yalnız bundan ibarət idi ki, bir söz hazırlamışdım, özümə çox xoş gəlmişdi və qorxurdum ki, Əbu Bəkr onu çatdıra bilməsin." Sonra Əbu Bəkr danışmağa başladı və xalq içində ən bəlağətli şəkildə danışdı. O, çıxışında dedi: "Biz əmirlərik, siz isə vəzirlərsiniz." Bunun üzərinə Hubab bin əl-Münzir dedi: "Xeyr! Allaha and olsun, biz belə etməyəcəyik! Bizdən bir əmir, sizdən də bir əmir olacaq!" Əbu Bəkr isə dedi: "Xeyr, biz əmirlərik, siz isə vəzirlərsiniz. Çünki (Qureyş) ərəb diyarlarının mərkəzində yerləşirlər və nəsəb baxımından onların arasında ən fəzilətli olanlardır. Elə isə Ömərə və ya Əbu Ubeydə ibn əl-Cərrah'a beyət edin!" Ömər dedi: "Əksinə, biz sənə beyət edirik. Sən bizim ağamızsan, ən xeyirlimizsən və Allah Rəsulunun – salləllahu aleyhi və səlləm – yanında ən sevimlimizsən!" Bununla Ömər onun əlindən tutdu və ona beyət etdi, insanlar da ona beyət etdilər."[870] Bu rəvayət, ümumiyyətlə Səqifə hadisəsi haqqında varid olmuş digər xəbərlər bizə göstərir ki, ənsarın bir araya toplanıb müsəlmanlar üçün yeni bir əmir seçmək təşəbbüsləri çox təhlükəli bir məqam idi. Bu

---

[869] "Sahih əl-Buxari", 1185

[870] "Sahih əl-Buxari", 3467

təhlükənin qarşısını almaq üçün hərəkətə keçən yenə də Əbu Bəkr və yoldaşları oldu. "Sahih əl-Buxari" kitabındakı rəvayətdə Ömər hadisələri danışarkən deyir ki, Ənsar "hamılıqla Saidə oğullarının çatısı altında toplanmışdılar, Əli, əz-Zubeyr və onunla olanlar bizdən ayrılmışdılar və mühacirlər Əbu Bəkr'in ətrafında toplanmışdılar. Əbu Bəkrə dedim ki, "gəl ənsardan olan o qardaşlarımızın yanına gedək..."[871] Ibn Həcər qeyd edir ki, Cuveyriyyə'nin Malik'dən rəvayətində bu hissəni bu şəkildə qeyd edir: "Biz Allah Rəsulunun – salləllahu aleyhi və sələm – evində olduğumuz bir vaxtda, birdən bir kişi divarın o tayından səslənərək dedi: "Ey Xəttab oğlu, bayıra çıx!" Mən dedim: "Əl çək məndən, mən məşğulam." O isə dedi: "Bayıra çıx! Çünki mühüm bir iş baş verib. Ənsar bir araya gəliblər. Aranızda savaş çıxaracaq bir iş görmədən əvvəl onlara yetişin!" Bunun üzərinə mən Əbu Bəkrə dedim: "Dur, gedək!"[872] Bütün bu dediklərimizin işığında belə bir sual ilə üzləşirik. Nə üçün Əli bin Əbi Talib - kərraməllahu vachəhu - iddia olunan imamlıq vəzifəsini qorumaq üçün, ona sahib çıxmaq üçün hərəkətə keçmədi? Əgər imamlıq məqamı müsəlman ümmətinin dünyada ikən azmaması və Axirətdə isə qurtulması üçün şərt idisə Əli bunu niyə ehmal etdi? Nə üçün ənsarın toplandığı yerə gələrək ümmətin gələcəyi üçün zəruri olan qərarın qəbul edilməsində iştirak etmədi. Bu barədə ət-Tabrasi'nin "əl-İhticac" kitabında verilən cavab bundan ibarətdir ki, "Əli bin Əbi Talib Allahın elçisinin cənazəsini hazırlamaqla məşğul idi."[873] Lakin bu cavab doğru bir cavab ola bilməz, çünki Peyğəmbərin - salləllahu aleyhi va əlihi va sələm - mübarək cənazəsini hazırlayan təkcə Əli deyildi. Amir əş-Şabi deyir: "Peyğəmbəri - salləllahu aleyhi va sələm - Əli, əl-Fədl və Usəmə bin Zeyd yudular və qəbrinə də onlar daxil etdilər. Mərhəb və ya İbn Əbi Mərhəb mənə rəvayət etdi ki, onlar öz yanına Abdurrahmən bin Auf'u da aldılar. Əli qurtardıqda dedi: "İnsanla onun əhli məşğul olmalıdır."[874] Said bin əl-Museyyəb isə rəvayət edir ki, Əli bin Əbi Talib'i belə deyib: "Allahın elçisini - salləllahu aleyhi va sələm - yudum və ölüdə olan şeylərin onda da olub olmayacağına baxmağa başladım, lakin heç bir şey görmədim; həm sağ ikən, həm də ölü ikən gözəl qoxulu və pak idi. Onun dəfn olunması və kəfənlənməsi ilə insanlardan kənar olaraq dörd nəfər məşğul oldu: Əli, əl-Abbas, əl-Fədl və Allahın

[871] "Sahih əl-Buxari", 6830;

[872] İbn Həcər, "Fəthul-Bari", 12/150-151; İbn Rüşd, "əl-Bəyən vat-Təhsil", 18/213;

[873] ət-Tabrasi, "əl-İhticac", 1/94;

[874] "Sunən Əbi Davud", 3209

elçisinin - salləllahu aleyhi va səlləm - azadlı köləsi Saleh. Allahın rasulu üçün - salləllahu aleyhi va səlləm - üçün ləhd qazıldı və üstünə kərpiclər düzülərək hörüldü."[875] Həmçinin bir başqa səhih hədisdə Bəhz ibn Əsəd deyir: ""Mən Allah Rəsulunun – salləllahu aleyhi və səlləm – cənazə namazında iştirak etmişdim… Peyğəmbər – salləllahu aleyhi və səlləm – qəbrindəki **ləhdə** qoyulduğu zaman, Muğirə dedi: "Onun ayaqlarının bir hissəsi hələ düzəldilməyib." Dedilər: "O zaman içəri gir və düzəlt." O da içəri girdi, əlini uzadıb Allah Rəsulunun – salləllahu aleyhi və səlləm – ayaqlarına toxundu, sonra dedi: "Üzərimə torpaq atın." Onlar da onun üstünə torpaq tökdülər, ta ki, torpaq baldırlarının yarısına qədər çatdı. Sonra Muğirə qəbirdən çıxdı. O sonralar belə deyərdi: **"Mən Allah Rəsulu ilə ən son vidalaşanınızam.""**[876] Əli bin Əbi Talib isə - radiyallahu anhu - Muğira'nın bu sözünü inkar etmiş və Allah rasuluna - aleyhissalətu vassələm - ən son toxunan şəxsin onun əmisi oğlu Qusəm bin əl-Abbas olduğunu demişdir.[877] Belə anlaşılır ki, Allahın elçisinin  cənazəsi ilə məşğul olanların arasında əmisi Abbas, onun oğullarından Fədl və Qusəm, həmçinin Usəmə bin Zeyd və azadlı köləsi Saleh də var idi. Bir sözlə Əli - radiyallahu anhu - cənazə işləri ilə məşğul olmasaydı Allahın elçisinin cənazəsi əlbəttə ki, aralıqda qalmayacaqdı, şübhəsiz ki, Haşim oğullarından bu işi görəcək kifayət qədər mömin var idi. Ona görə də bu, heç bir şəkildə üzr ola bilməz. Burada iki hal mümkündür, ya Əli bin Əbi Talib Mədinədə ənsarın etdiklərindən xəbərdar idi, lakin bununla belə cənazə işləri ilə məşğul olmağa üstünlük verdi. Ya da baş verənlərdən xəbərsiz idi, ona görə də iştirak etməsi imkansız idi. Əlinin vəzifələndirilmiş imam olduğunu söyləməklə yanaşı onun Səqifədə bu baş verənlərdən xəbərsiz olduğunu söyləmək iki səbəbə görə qəbul edilə bilməz. Birinci səbəb budur ki, əgər Əli bin Əbi Talib – radiyallahu anhu – həqiqətən də Peyğəmbərdən sonra xəlifə təyin edilmişdisə Səqifədəki yığıncaqdan xəbəri olan bir Allah bəndəsinin gəlib bunu gözlənilən xəlifəyə və ya onun yaxınlarına xəbər verməməsi çox uzaq ehtimaldır; Mədinə kiçik bir cəmiyyət idi və ənsarın arasında Əli'ni – kərraməllahu vachəhu - sevən və ona xüsusi rəğbət bəsləyən kəslər az deyildi. Bunu şiə alimləri özləri də təsdiq edirlər. Necə ola bilər ki, Əlinin Peyğəmbərdən sonra müsəlmanların başında əmir olacağını gözləyən heç bir kimsə bu yığıncaq ilə bağlı xəbəri ən azından Haşim oğullarına, dolayısıyla da

[875] əl-Hakim, "əl-Mustədrak", 2/259 (1355) ər-Risalə çapı.

[876] "Musnəd Əhməd", 34/365 (20766) Şeyx Şueyb isnasının səhih olduğunu yazır.

[877] "Musnəd Əhməd", 2/174 (787) Şeyx Şueyb isnadının həsən olduğunu deyir.

Əlinin özünə xəbər vermədilər?! İkinci səbəb isə bunun ilahi təyinat olması iddiası ilə bağlıdır; əgər Əlini məsum qılan, onu möminlərin üzərində əmir təyin edən, Muhəmməddən sonra bəşəriyyət üçün onu höccət qoyan, ona bəşəriyyətin ehtiyac duyduğu bütün elmləri öyrədən Allahdırsa bu kritik məqamda onu – radiyallahu anhu – qafil buraxması Allahın – azzə va cəllə - hikmətinə yaraşmaz. Təsəvvür edin ki, Rəbbindən lövhələri təslim almış Musa peyğəmbər öz qövmünün yanına qayıtmaq və onlara Allahın hökmlərini çatdırmaq üçün dağdan aşağıya enərkən bir-neçə quldur onun qarşısını kəsir və onun əlindəki lövhələri alırlar və Allah Musanı bütün bunlardan xəbərdar etmir. Bunu ağlın qəbul etmirsə o zaman necə qəbul etmək olar ki, imamlığın ilk günündə Mədinənin bağlarından birində açıq bir məclisdə İmamın məqamının qəsd olunması planlaşdırılarkən Allah bunu imamından gizlədib və bu barədə onu xəbərdar etməyib?! Allah İlahi lütfə və hikmətə inanan bir şiə olaraq belə bir ehtimalı necə qəbul etmək olar?! Xütbə verərkən xəlifə Ömərə İran ərazisində həzimətlə üzləşmiş müsəlman ordusunu göstərən Allah nə üçün ümmətin ən əhəmiyyətli anlarından birində Əlini köməksiz buraxmış olsun ki?! Təbii ki, belə bir iddia çox absurd səslənir. Əgər desək ki, Əlinin bundan xəbəri olub, lakin bununla bağlı heç bir tədbir görməyib o zaman bu, onun üçün ciddi bir qüsur olardı, çünki imamət dediyimiz kimi vəzifədir, ona verilmiş bir haqq deyildir; vəzifənin məsuliyyəti qarşısında əziyyətə qatlanmaq və lazım olan tədbirləri görmək vacibdir. Əlinin – radiyallahu anhu – Allahın ona belə bir vəzifə verdiyinə etiqad etdiyi halda mühacirlər və ənsarın onun əlindən bu vəzifəni aldıqlarına bilməsinə baxmayaraq bununla bağlı heç bir şey etmədiyini söyləmək Əliyə qarşı bir iftiradır. Biz şəkk etmirik ki, Əliyə belə bir vəzifə tapşırılmış olsaydı o, bu işi belə buraxmazdı, əksinə o yığıncaqda gedib haqq sözü söyləyərdi, onlara ilahi təyinatı xatırladardı və Ənsarın dəstəyini qazanmağa çalışardı. Əlinin bunu etməməsi yalnız və yalnız bir şeyə dəlalət edir: O, ona elə bir vəzifənin verildiyinə inanmırdı və üzərində belə bir məsuliyyətin olmasından xəbərsiz idi.

Bizi düşündürən məqamlardan biri də Peyğəmbərimizin – aleyhissalətu vassələm – cənazə namazının qılınması şəklində özünü göstərir. Məlumdur ki, peyğəmbərin – aleyhissalətu vassələm – cənazəsinə heç kim imamlıq etməyib, səhabələr onun cənazəsini kiçik qruplar şəklində və ya tək-tək qılıblar. Said bin əl-Museyyəb deyir: “Onlardan heç biri peyğəmbərin - salləllahu aleyhi va səlləm - cənazəsinə imamlıq etmədi, qruplar şəklində, kişilər, qadınlar və

uşaqlar olaraq onun cənazəsinin olduğu evə daxil olurdular, dua edirdilər və çıxırdılar, sonra başqaları girirdi." Bunu rəvayət edən Abdurrazzəq əs-Sanani arxasından səhih isnad ilə Muhəmməd əl-Baqir'in belə dediyini rəvayət edir ki, "onun cənazəsi imamsız qılındı."[878] İbn Əbi Şeybə başqa bir isnadla İmam Muhəmməd əl-Baqir'in belə dediyini rəvayət edir: "Peyğəmbərin - salləllahu aleyhi va səlləm - namazına heç kim imamlıq etmədi; qruplar şəklində daxil olub namaz qılardılar və çıxardılar."[879] İbn Abdilbərr yazır: "Onun cənazəsinin ayrılıqda tək-tək qılınmasına gəldikdə nəql və siyər əhli nəzərində icma məsələsidir, bunda ixtilaf etməyiblər."[880] Təbii ki, səhabələrin camaat şəklində cənazə qılmamaqları bir sual ortaya qoyur; nə üçün belə etdilər? Çünki İslamda cənazənin məlum bir forması var idi, ciddi bir səbəb olmadan bunu tərk etmək doğru olmazdı. İmam əş-Şafi bu barədə danışarkən deyir: "İnsanlar Allahın elçisinin - salləllahu aleyhi va səlləm - cənazəsini təklikdə qıldılar, heç kim onlara imamlıq etmədi. Bunun səbəbi Allahın elçisinin - salləllahu aleyhi va səlləm - cənazəsinin əzəmətinə görə idi və onun cənazəsində başqa heç kimin imam olmaması üçün öz aralarında yarışırdılar."[881] əş-Şafinin bu sözlərini izah edən ər-Ramli deyir: "Çünki onlara imamlıq edəcək bir imam hələ müəyyən edilməmişdi, buna görə də bir kimsə cənazədə önə keçib imamlıq etsəydi qalan bütün işlərdə öndər olacaqdı və xəlifəliyə seçiləcəkdi."[882] Bütün bunlar onu göstərir ki, əgər insanların nəzərində və zehnində Əli bin Əbi Talibin haqq xəlifə olması sabit olsaydı o zaman təbii olaraq cənazəyə onun imamlıq etməsi gözlənilməli idi. Əlinin özü tərəfindən də belə bir təşəbbüs olmayıb, halbuki yuxarıda qeyd etdiyimiz kimi imamlıq sadəcə bir imtiyaz deyildi, hər şeydən əvvəl məsuliyyət və vəzifə idi. Allahın elçisi - salləllahu aleyhi va səlləm - həqiqətən də bütün səhabələrin qarşısında Əli bin Əbi Talibi - kərraməllahu vachəhu - xəlifə və imam təyin etmişdisə o zaman Əli heç kimin dəvətini və ya təqdirini gözləmədən vəzifələrinə başlamalı idi. Bunun üçün çıxıb xütbə verməli, insanlara nə edəcəklərini izah etməli, göstəriş verməli idi. Amma bunun əksi olaraq peyğəmbərin - aleyhissalətu vassələm - vəfatının nəticəsi olaraq ortaya çıxmış heyrət və böhran məqamında heç bir addım atmadı. Bunun ən

---

[878] Abdurrazzəq, "əl-Musannəf", 4/199;

[879] İbn Əbi Şeybə, "əl-Musannəf", 21/129 (39802)

[880] İbn Abdilbərr, "ət-Təmhid", 24/397;

[881] əş-Şafi, "Kitəb əl-Umm", 1/314;

[882] ər-Ramli, "Nihəyətul-Muhtəc", 2/482

bəsit izahı budur ki, Əli bin Əbi Talib özünün insanların imamı, peyğəmbərin xəlifəsi olduğuna inanmırdı. İnanmış olsaydı heç bir şəkildə bu məsuliyyətli işdə qüsurlu davranmazdı, çünki biz Əlinin hər şərtdə vəzifəsinin haqqını verdiyini görmüşük.

Burada Səqifə ilə bağlı daha bir məsələyə diqqət çəkmək lazımdır. Səqifədə ənsarlar özlərindən bir əmirin, mühacirlərdən də bir başqa əmirin olmasını tələb edirdilər. Mühacirlər isə onlara "imarət yalnız Qureyşdə olar" hədisini xatırladırlar. Əgər peyğəmbər özündən sonra Əlini vali təyin etmişdisə o zaman ənsarlar hədisi arqument gətirənlərə qarşı mühacirlərə Əlinin haqqını xatırlada bilərdilər. Əgər mühacirlərin həmin məclisdə gətirdikləri ən güclü arqument əmirliyi ümumilikdə Qureyşə xas qılan peyğəmbərimizdən - salləllahu aleyhi va səlləm - eşitdikləri hədis idisə, əgər əmirliyə olan iddialarını məhz bu hədisə görə tərk etməli oldularsa o zaman nə əcəb ənsarlar həmin əmirliyi xüsusilikdə Əliyə xas qılan hansısa bir hədisi arqument olaraq gətirmədilər və əksinə Əbu Bəkrin xəlifəliyinə razı oldular?! Öz doğma şəhərlərində öz ambisiyalarını Teym qəbiləsindən olan bir mühacirin xatirinə qurban verməklərinin arxasında duran səbəb nə ola bilərdi?! Əgər bu, iman etdikləri peyğəmbərin - aleyhissələm - sözünə tabeçilik əzmi deyildisə bunu başqa nə ilə izah etmək olar?! Həmin məqamda nə Əbu Bəkr, nə Ömərin, nə də qeyrisinin Mədinədə hərbi gücü və ya kütləvi dəstəyi yox idi ki, bunu qorxu və acizlik ilə izah edək. Bu sualın cavabı çox aydındır. Yəsrib şəhərinin həqiqi sahibləri olan ənsar sadəcə olaraq bir hədis qarşısında boyun əyərək təslimiyyət göstərdilər. Yoxsa ənsar olaraq tanıdığımız və Allahın Öz Kitabında təriflədiyi həmin qövm də həqiqətdə Əliyə nifrət edən münafiqlərdən ibarət idi?! Məgər şiə müəlliflər özləri ilkin şiələri sadalayarkən onların arasında Xuzeymə bin Səbit, Əbu Əyyub əl-Ənsari, Cabir bin Abdilləh, Əbul-Heysəm ibn ət-Tayyəhən, Qeys ibn Sad bin Ubədə, əl-Bəra bin Azib, Ubeyy bin Kəb, Useyd bin Sələbə, Bəşir ibn Məsud, Əbi Fudalə, əl-Haris bin ən-Numən, Rafi bin Xudeyc, Kəb bin Umeyr, Əbu Ducənə Simək bin Xaraşə, Suheyl bin Amr, Səbit bin Ubeyd, Səbit ibn əl-Xatim, Səhl bin Huneyf kimi ənsardan olan səhabələrin adlarını qeyd etmirlərmi?[883] Bəs necə olur ki, "əmirliyin Qureyşdə olduğunu" xatırladan mühacirələrə ənsarlar əmirlik nəinki qureyşdə, hətta məhz peyğəmbərin nəslindədir iddiasını xatırlatmadılar?! Halbuki şiələrin öz iddialarına görə ənsardan çox sayda səhabə Əlinin şiəsi idi, amma bununla belə ğadir-xum hədisini əks arqument kimi istifadə etmədilər.

---

[883] Əhməd əl-Vaili, "Huviyyətut-Təşəyyu", səh: 33-35;

Əgər “imamlar Qureyşdəndir” hədisi ümumi dəlildirsə o zaman Əlinin xəlifəliyinə dəlalət edə biləcək istənilən hədis xüsusi bir dəlil olmalı idi; əllərində konkret xüsusi bir dəlil olduğu halda nə üçün ənsarlar əmirliyi Əliyə yox, Əbu Bəkrə buraxdılar?! Əhməd əl-Vaili’nin iddiasına görə bu ənsarlar “İmam Əlinin xilafətə daha layiq olduğuna inanırdılar…”[884] Məgər qəribə hal deyildirmi ki, Əliyə xüsusi rəğbət bəslədikləri halda ənsar Əbu Bəkr və Ömərə qarşı Əlinin təyinatı ilə bağlı heç bir hədisi dəlil gətirmədilər?! Fəxruddin ər-Razi “Məalim Usul əd-Din” kitabında yazır: “Ənsar imam məqamını özləri üçün istədiklərində Əbu Bəkr onlara mane oldu. Əgər belə bir nass mövcud olsaydı Əbu Bəkrə deyərdilər ki, “ey Əbu Bəkr! Biz xəlifəliyi haqsız yerə özümüzə götürmək istədiyimizdə bizə mane olduğun kimi biz də sənin xəlifəliyi qəsb etməyinə, zülm etməyinə mane oluruq və bu məqamı öz əhlinə veririk və o, Əlidir…. Əli - radiyallahu anhu - (bir çox münasibətdə) gizli nasları zikr edib, amma onun hansısa toplantıda aşkar bir nassı zikr etdiyi nəql olunmayıb. Əgər belə bir nass mövcud olsaydı gizli nass yerinə onu zikr etmək daha münasib olardı.”[885] Şəmsuddin əl-İsfəhani də bu nöqtəyə toxunaraq deyir ki, “əgər peyğəmbər - aleyhissalətu vassələm - tərəfindən təyin olunmuş biri olsaydı və bu təyinat məşhur olsaydı, o zaman səhabələrdən heç kimsənin (peyğəmbərin ölümündən sonra baş vermiş) bu ixtilafı inkar etməməsi və “peyğəmbər fılankəsi təyin etmiş olduğu halda bu nə ixtilafdır?!” deməmiş olması adətən imkansız bir haldır.”[886] Həmçinin İbn Həcər əl-Məkki yazır: “Əgər Əli haqqında nass olsaydı Əli ona əsaslanaraq başqasının seçilməsinə mane olardı, necəki Əbu Bəkr, ənsarın yanında Əlidən də (nüfuz və dəstək baxımından) zəif olmasına baxmayaraq “İmamlar Qureyşdəndir” hədisi ilə ənsara mane oldu, beləliklə də bu hədisin əhəd hədis olmasına baxmayaraq ona itaət etdilər və iddia etdikləri imamlıq məqamını tərk etdilər. İmamət məsələsində əhəd xəbərə qarşı asilik etməyən, din uğrunda öz canlarını, mallarını fəda etməklə, öz ailələrini və vətənlərini tərk etməklə, övladlarına və atalarına qarşı vuruşub öldürməklə dinə xidmətdə ən üstün mərtəbədə olduqlarını göstərə bilmiş bir qövmün arasında olduğu halda Əli onlara qarşı açıq-aşkar nassı arqument olaraq gətirmirsə, ümumiyyətlə bütün bu müzakirələr əsnasında onlardan heç biri - “əlimizdə fılankəsin təyinatı ilə bağlı nass olduğu halda nəyin mübahisəsini edirsiz?!” - demirsə, o zaman Əlini

[884] Eyni mənbə, səh: 37;

[885] İbn ət-Tilmisəni, “Şərh Məalim Usul əd-Din”, səh: 676-677;

[886] əl-İsfəhani, “Təsdid əl-Qavaid”, səh: 1069; Dar əd-Diya

təyin edən açıq-aşkar bir nassın olduğunu necə təsəvvür etmək mümkündürki?! Əgər kimsə iddia edib desə ki, Əli onlara bu nassı xatırladıb, lakin onlar itaət etməyiblər, belə birisi cahildir, sapıqdır, müftəridir, zəruri olaraq bilinən şeyləri inkar edən biridir, ona görə də ona əhəmiyyət verilməz."[887] Həqiqətən də belə bir vəziyyəti təsəvvür etmək çətindir, hətta örfən imkansızdır. Necə ola bilər ki, peyğəmbər - aleyhissalətu vassələm - özündən sonra xəlifənin kim olduğunu bütün ümmətin qarşısında desin və onu vəliəhdi olaraq təyin etsin, lakin vəfat etdikdən sonra imamətlə bağlı baş vermiş toplantıların heç birində nə Əlinin özü, nə ənsarlar, nə də mühacirlər bu təyinatı heç bir şəkildə müzakirə etməsinlər?! Belə bir halın yalnız tək bir izahı ola bilər. Səhabələr belə bir təyinatın olduğuna inanmırdılar. Şiə alimləri özləri də bilirlər ki, Əli bu toplantılarda özünün xəlifə təyin edildiyini irəli sürməyib. Şeyxut-Taifə ət-Tusi buna izah gətirmək üçün yazır ki, guya Əli ehtiyat edib, çünki əgər haqqını tələb etsəydi onu və ailəsini öldürərdilər.[888] Axı nə üçün? Unutmayaq ki, Əli və onun ailəsi əslində peyğəmbərin - aleyhissələm - ailəsidir. Əli hakimiyyətə keçməsin deyə peyğəmbərin - aleyhissələm - ailəsini öldürəcəkdilərmi?! Peyğəmbərə - aleyhissələm - dəstək olmaq üçün hər şeylərini, canlarını və mallarını fəda etmiş bir qövmün sadəcə olaraq peyğəmbərin kürəkəni və əmisi oğlunun hakimiyyətə gəlməməsi üçün onun ailəsini öldürməyə hazır olduğunu təsəvvür edə bilirsizmi?!

Bu toplantılarda təyinat məsələsinin ümumiyyətlə müzakirə olunmaması faktından başa düşürük ki, Səqifədə toplaşmış və həmçinin digər toplantılarda bir araya gəlmiş səhabələr Əlinin peyğəmbərdən sonra xəlifə olduğuna etiqad etmirdilər və Əli də daxil olmaqla onlardan heç biri nass məsələsini müzakirə etməyiblər. Hətta bunu şiə alimləri özləri də etiraf ediblər. Yuxarıda Şeyxut-Taifə ət-Tusi'nin sözü ilə tanış olduq. Onun müəllimi əl-Murtəda əş-Şərif isə yazır: "Əlinin - əleyhissalam - şurada - bu halda daha güclü və daha möhkəm olmasına baxmayaraq - nassı dəlil gətirməsinə mane olan səbəb elə (Səqifədə) mane olmuş birinci səbəbin özüdür, çünki şurada iştirak edənlər əvvəlki xəlifələrin həqiqi imamlar olduğuna və o ikisindən başqası haqqında nassın olmasının batil olduğuna etiqad edirdilər…"[889] Dolayısıyla bu görkəmli şiə alimi burada iki şeyi etiraf etmiş olur; birinci etirafı budur ki, Əli bin Əbi Talib nə birinci

[887] İbn Həcər, "əs-Savaiq əl-Muhriqa", 1/103;

[888] "Məsələtun Uxra fin-Nass alə Ali", səh: 27; əl-Mutəmər əl-Aləmi, 1413

[889] "əş-Şəfi fil-İmamə", 2/113; Bax həmçinin "Cəvab əl-Məsəil ət-Tarablusiyyə", 1/149-150;

toplantıda, nə də şura toplantısında peyğəmbərin - salləllahu aleyhi va alə əlihi va sələm - onu xəlifə təyin etməsi ilə bağlı heç bir nassı arqument gətirməyib. İkinci etirafı isə budur ki, həmin toplantıda iştirak edən səhabələr Əbu Bəkr və Ömərin həqiqi imamlar olduqlarına inanırdılar, hansısa bir nassın olduğuna və Əbu Bəkrin, Ömərin bu nassa qarşı çıxdığına etiqad etmirdilər. Əgər bu səhabələr həqiqətən də peyğəmbərin - aleyhissalətu vassələm - özündən sonra Əlini xəlifə təyin etdiyini eşitmişdilərsə necə ola bilərdi ki, bunu eşitdikləri halda buna etiqad etməsinlər?! Yəni belə bir təyinat baş vermişdisə ən azından bunun olduğuna etiqad etməkləri vacib idi. Əlinin heç bir yerdə xəlifəliyin və imamlığın onun haqqı olduğunu isbat etmək üçün ğadir-xum və digər hədisləri dəlil gətirmədiyini tarixi rəvayətlər təsdiq edir. Şiə alimlərindən Heydər Əli Qələmdəran əl-Qummi[890] ilk sira və tarix kitablarından "səqifə" hadisəsini nəql edir və sonra deyir: "Bu, Bənu Saidənin səqifəsi hadisəsinin İslam tarix kitablarında və etibarlı mənbələrdə qeyd olunan hekayəsidir. Şiələrin qədim kitablarında - kiçik bir şey müstəsna olmaqla - buna müxalif olacaq heç bir şey yoxdur. Bunların heç birində ğadir xum məsələsinin zikr olunduğuna və İmam Əli'nin onu dəlil gətirdiyinə dair bir şey yoxdur."[891] Xəlifə ikən Əlinin – radiyallahu anhu – Müaviyəyə və ya başqalarına yazdığı məktublarda da belə bir təsəvvür öz əksini tapmır. Misal üçün ona nisbət edilmiş belə məktublardan birində deyir: "Mənə beyət edənlər, Əbu Bəkrə, Ömərə və Osmana hansı şərtlərlə beyət etdilərsə, eyni şərtlərlə mənə də beyət etmişlər. Belə bir vəziyyətdə hazır olanın seçim etmək haqqı olmadığı kimi, hazır olmayanın da bu qərarı rədd etmək haqqı yoxdur. Şura haqqı yalnız mühacirlər və ənsara məxsusdur. Onlar bir şəxs üzərində razılaşıb onu imam olaraq təyin edərlərsə, bu,

---

[890] Heydər Əli Qələmdəran 1913-cü ildə Dizican kəndində kasıb bir ailədə anadan olub. Maddi imkansızlığa baxmayaraq, gizlicə dərsləri dinləyərək təhsil alıb və elmə böyük maraq göstərib. Atası onun dini təhsilinə mane olub, lakin atasının ölümündən sonra tam şəkildə təhsilə yönəlib. Qum və Tehranda müxtəlif jurnallarda yazılarla çıxış edib, İslamı müdafiə edən məqalələr və islahatçı fikirlər yayıb. Şeyx Muhəmməd Mehdi əl-Xalisi'nin əsərlərini tərcümə etmiş, lakin bəzi İmamiyyə inanc prinsiplərini tənqid edərək xümsün vacibliyini, qeybə çəkilmiş imam fikrini və on iki imamın təyin olunmuş məsumlar olması fikrini rədd etmişdir. Bu səbəbdən iki dəfə sui-qəsdə məruz qalıb və həbs olunub. O, Mühəndis Mehdi Bəzərqan və Dr. Əli Şəriəti kimi ziyalılarla münasibətdə olub, onların düşüncəsinə təsir göstərib. Mürtəza Mutəhhəri də onun əsərlərini bəyənsə də, ictimai təzyiqlərdən çəkinərək açıq münasibət qurmamışdır. Qələmdəran " İslamda Hökumət", "əl-Xüms", "Zəkat kitabı" və "Tariq əl-İttihad" kimi bir sıra mühüm əsərlərin müəllifidir. O, sadə və zahid həyat tərzi sürmüş və elmə sadiq qalmışdır. 1989-cu ildə, Ramazan ayının 29-da 76 yaşında vəfat etmiş və sadə bir mərasimlə dəfn olunmuşdur.

[891] Qələmdəran, "Tariqul-İttihəd", səh: 75;

Allahın razılığına uyğun olar. Əgər kimsə onların qərarına qarşı çıxaraq fitnə və bidətlə ortaya çıxarsa, onu əvvəlki vəziyyətinə geri qaytararlar. Əgər imtina edərsə, möminlərin yolundan başqa bir yolu tutduğu üçün onunla döyüşərlər və Allah onu seçdiyi yolda qoyar."[892]

Əgər Qədir Xum günündə peyğəmbər – salləllahu aleyhi va səlləm – Əlini özündən sonra xəlifə təyin etmişdisə, Səqifədə bu əhdə xəyanət etdilərsə nə üçün ən azından Salman əl-Farisi, Ammar bin Yəsir, əl-Miqdəd bin Amr, Əbu Zərr əl-Ğifəri kimi səhabələr etiraz etmədilər, Əlinin haqqını tələb etmədilər?! Nə üçün bu barədə onlardan hədis rəvayət edənlər belə bir mövqe nəql etməyiblər? Halbuki Zubeyrin ilk beyət edənlərin arasında olmadığını, Əli ilə birlikdə olduğunu rəvayət ediblər. əl-Muhəqqiq əl-Hilli iddia edir ki, belə bir etiraz olub və yazır: "Necəki rəvayət olunub ki, Sad bin Uveymir bin Suadə deyib: "Şübhəsiz ki, xəlifəlik peyğəmbərin əhlu beytindən başqasında olmaz! Ona görə də onu, Allahın aid etdiyi yerə aid edin!"[893] Kitabı təhqiq edən etiraf edir ki, nə Sad bin Uveymirin kimliyini, nə də ondan gələn bu xəbəri müəyyən edə bilib. əl-Hilli daha sonra Əlinin imamlığına dair nassa şahidlik edən səhabələrin arasında Əbu Zərr, əl-Miqdad, Cabir, Salman, Xuzeymə bin Sabit, Səhl bin Huneyf, Əbu Əyyub, Sad bin Ubədə, oğlu Qeys bin Sad, Ubədə bin Samit kimi səhabələrin adlarını çəkir. Şiə kitabları bu nöqtəni isbat etmək üçün bir adət olaraq əs-Saduq'un "əl-Xisal" kitabında zikr etdiyi rəvayəti qeyd edirlər, beləki bu uzun xəbərə görə mühacirlərdən və ənsardan on iki nəfər Əbu Bəkr xəlifə seçildikdə ona etiraz ediblər. Bunlar mühacirlərdən Xalid bin Said ibn əl-As, əl-Miqdad bin əl-Əsvad, Ubeyy bin Kəb, Ammar bin Yasir, Əbu Zərr əl-Ğifəri, Salman əl-Farisi, Abdullah bin Məsud, Bureydə əl-Əsləmi və ənsardan isə iki şəhadət sahibi Xuzeymə bin Səbit, Səhl bin Huneyf, Əbu Əyyub əl-Ənsari, Əbul-Heysəm bin ət-Tihən və başqaları idilər. Bu xəbərə görə onlar Əbu Bəkri minbərdən endirməyi qərar verirlər, Əli ilə məşvərət edirlər və sonra Əbu Bəkr minbərdə ikən bir-bir qalxıb uzun-uzadı etirazlar edirlər. İddiaya görə bu etirazlardan sonra Əbu Bəkr öz evində üç gün qaldı, ondan sonra Ömər, Talha, Zubeyr, Osman, Abdurrahmən bin Auf, Sad bin Əbi Vaqqas, Əbu Ubeydə hər biri öz əşirətlərindən on nəfərlə, qılıncları çəkilmiş halda Əbu Bəkri evindən gətirdilər və bir daha minbərə çıxdı və onlardan bir carçı aləmə car çəkərək bir daha o cür etiraz edilməsini qadağan

[892] "Nəhcul-Bəlağa", 3/7;

[893] əl-Hilli, "əl-Məslək fi Usul əd-Din", səh: 195;

etdi.[894] Lakin bu rəvayət şiələrin öz meyarlarına əsasən məchul bir rəvayətdir, çünki isnadındakı Əli bin Əhməd bin Abdilləh əl-Bərqi məchul ravidir.[895] Atası Əhməd bin Abdilləh də oğlu kimi məchuldur.[896]

Üstəlik necə olur ki, Mədinə şəhərində çoxluğu və gücü əlində tutan və əmirliyi özlərində saxlamağa rəğbət göstərən ənsarlar Əbu Bəkrin gətirdiyi tək bir hədisin qarşısında təslimiyyət göstərdilər, amma Əli haqqında iddia olunan mütəvatir xəbərə boyun əymədilər?! Bu nə Əbu Bəkrin aid olduğu qəbilənin gücü ilə, nə də ümumiyyətlə mühacirlərin gücü ilə izah oluna bilməz. Bunun tək bir izahı budur ki, ənsarlar peyğəmbərə - aleyhissələm - iman etmiş bir qövm olaraq onun sözünə tabe oldular. Əhməd və digərlərinin rəvayət etdikləri hədisdə Humeyd bin Abdirrahmən rəvayət edir ki, Əbu Bəkr Səqifə toplantısında ənsarın böyüyü Sad bin Ubədəyə dedi: "Ey Sad, sən bilirsən ki, (bir gün) Allahın elçisi - salləllahu aleyhi va səlləm - dedi - və sən o zaman oturmuşdun - ki, "Qureyş bu işin sahibləridir…" Sad ona dedi: "Doğru deyirsən."[897] Beləliklə də Sad bu hədisi eşitdiyini təsdiqlədikdən sonra ənsardan olan digər səhabələr də bu hədisin gərəkdirdiyi mənaya tabe oldular. Digər məqamda peyğəmbərin - aleyhissələm - harada dəfn edilməsi üzərində ixtilaf etdiklərində Əbu Bəkr onlara dedi: "Allahın elçisini - salləllahu aleyhi va səlləm - belə deyərkən eşitdim: "Heç bir peyğəmbər öldüyü yerdən kənarda dəfn edilməyib." Bundan sonra səhabələr yatağını çəkərək onun yatağı altında qəbrini qazdılar."[898] Hər iki yerdə səhabələr peyğəmbərdən - aleyhissalətu vassələm - rəvayət edilən hədisə tabe olurlar və təslimiyyət göstərirlər. O zaman bu səhabələri necə ittiham etmək olar ki, onlar peyğəmbərin mütəvatir olaraq bilinən vəsiyyətinə bilərəkdən müxalif oldular və ona qarşı getdilər?! Ənsar da bu və buna bənzər məqamlarda təslimiyyət göstərib. Şiə alimi Muhsin əl-Əmin yazır: "Şəkk yoxdur ki, ənsarın istəyi Əli ilə idi."[899] Əliyə meyl edənlərin başında hətta Xazrəc qəbiləsinin böyüyü Sad bin Ubədə'nin özünü qeyd edir. Hətta əl-Muhəqqiq əl-Hilli səhabələr arasında Əlinin haqqını inkar etməyən,

---

[894] əs-Saduq, "əl-Xisal", 2/461-465; Camaatul-Mudərrisin, Qum, 1403

[895] əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 383; Muəssəsətut-Tərix əl-Arabi, Beyrut, 1430/2009

[896] Eyni mənbə, səh: 31;

[897] "Musnəd Əhməd"1/199 (19);

[898] Abdurrazzəq, "əl-Musannəf", 3/516 (6534) əl-Azami

[899] Muhsin əl-Əmin, "Ayənuş-Şiə", 7/225;

onu qəbul edən "haqq əhli səhabələr" arasında Sad bin Ubədə və oğlu Qeys'in də adını çəkir.[900] Deməli bütün bu iddialara görə İbn Ubədə nass məsələsini qəbul edənlərdən, etiraf edənlərdən idi. Amma məlumdur ki, Səqifə hadisəsində mühacirlər məclisə gəlmədən əvvəl Sad bin Ubədə ənsar tərəfindən imam və xəlifə seçilməyə hazırlaşırdı. Əlinin peyğəmbərdən - aleyhissalətu vassələm - sonra xəlifə olmasının ilahi bir təyinat olduğunu bilən, buna iman edən bir səhabə necə ola bilər ki, öz namizədliyini irəli sürsün?! Məgər bu aşkar şəkildə ona dəlalət etmirmi ki, Sad bin Ubədə belə bir təyinatın olmağından xəbərsiz idi?!

Beləliklə də Peyğəmbərin - aleyhissalətu vassələm - Əlini özündən sonra müsəlmanların üzərində xəlifə və imam təyin etdiyini səhabələrin bildiyi, lakin bununla belə onun əhdinə xəyanət etdikləri iddia olunur. Belə bir iddia səhabələrin Əli haqqındakı xəbərləri - ğadir-xum hədisi də daxil olmaqla - rəvayət etməkləri faktı ilə düz gəlmir. Əgər səhabələr ğadir-xum hədisindəki sözlərin xilafət təyinatı mənasında olduğunu bilirdilərsə o hədisi və digər hədisləri nə üçün rəvayət edirdilər?! Əgər o hədislərin tələbi ilə əməl etməli olduqları halda onunla əməl etməmişdilərsə o zaman o hədislər onların özlərinə qarşı ən böyük arqument olmalı idi. Halbuki bu səhabələr bu hədisləri öz tələbələrinə heç bir sıxıntı və problem görmədən rəvayət ediblər. Əksinə deməyimiz lazımdır ki, bu hədisləri rəvayət etmiş səhabələr o hədislərdən xilafət mənasını başa düşmədikləri üçün, sadəcə olaraq Əli üçün fəzilət olduğunu gördükləri üçün rəvayət ediblər. Şəmsuddin İbnud-Dəmiğani əl-Ələvi buna görə də yazır: "Bu hədisləri rəvayət edənlər Əbu Bərk və Ömərin xəlifəliklərinə etiqad edirdilər; bu isə ona dəlalət edir ki, onlar (bu hədislərdən) peyğəmbərin xilafəti qəsd etdiyini başa düşməyiblər."[901] Onlardan sonra gəlmiş əhlüs-sünnətin böyükləri də Əlinin fəzilətlərini rəvayət etməklə tanınıblar. Bunu nasibiliyə bulaşmış kütlələr arasında aşkardan təbliğ edərdilər, hətta Sufyan əs-Səvri'nin Basra və Şamda onun fəzilətləri ilə bağlı hədisləri rəvayət etdiyini bilirik.[902] İsmail bin Ayyəş isə Hums şəhərində insanların qarşısında bu hədisləri oxuyardı, hətta Hums şəhərindəki nasibiləri bu

---

[900] əl-Hilli, "əl-Məslək fi Usul əd-Din", səh: 232-233;

[901] İbnud-Dəmiğani, "əl-Cəvhəratul-Xalisa aniş-Şəvaib fil-Aqaid əl-Mənqumə alə Cəmi əl-Məzəhib", səh: 103-104; Al-Kamel Verlag, Köln, 2008

[902] Əbu Nueym, "Hilyətul-Əvliyə", 7/26-27; əl-Xatib əl-Bağdadi, "əl-Cəmi li Əxləq ər-Ravi", 2/118;

bidətlərindən döndərməyə nail olduğu yazılır.[903] Əli bin əl-Mədini bu fəzilət hədislərini Basra şəhərində, ən-Nəsəi isə Dəməşqdə insanların hüzurunda rəvayət edərdilər.[904]

Tarixi olaraq doğru olan budur ki, səhabələr ümumiyyətlə ğadir-xum hədisindən, ya da hansısa başqa bir hədisdən peyğəmbərin - aleyhissalətu vassələm - kimisə özündən sonra xəlifə təyin etdiyini başa düşməmişdilər. Müxtəlif yollarla rəvayət olunmuş xəbərlərdən də anlaşılan məna budur. İbn Abbas deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - ölüm yatağında xəstə ikən Əli bin Əbi Talib onun yanından çıxdı. İnsanlar soruşdular: "Ey Əbu Həsən, Allahın elçisi necədir?" Dedi: "Allaha həmd olsun ki, yaxşılaşıb." Sonra Abbas bin Abdilmuttalib onun əlindən tutdu və dedi: "Vallahi üç gündən sonra əsa köləsi olacaqsan və mən Allaha and olsun ki, Allahın elçisinin bu xəstəliyi səbəbi ilə öləcəyini görürəm; mən Abdulmuttalib oğullarının ölüm yaxınlaşdıqda üzlərini yaxşı bilirəm. Gəl bir yerdə Allahın elçisinin - salləllahu aleyhi va səlləm - yanına gedək və ondan soruşaq: "Bu iş kimin haqqıdır? Əgər bizimdirsə bilmiş olarıq, əgər bizdən başqasınındırsa bilmiş olarıq, ona görə də bizə vəsiyyə edər." Əli dedi: "Allaha and olsun ki, Allahın elçisindən - salləllahu aleyhi va səlləm - bunu soruşsaq və bizə verməsə, o zaman ondan sonra insanlar heç zaman bizə verməzlər. Allaha and olsun ki, bunu Allahın elçisindən soruşmayacam."[905] Aydındır ki, peyğəmbərin əmisi Abbas kiminsə artıq xəlifə təyin edildiyindən xəbəri yox idi. Abdullah bin Ömər rəvayət edir: "Ömərə (yaralı halda ölüm yatağında yatarkən) soruşuldu: "Özündən sonra bir xəlifə təyin etməyəcəksənmi?" Dedi: "Əgər özümdən sonra xəlifə təyin etsəm bunu məndən də xeyirli olan biri - Əbu Bəkr - edib. Əgər təyin etməsəm bunu məndən də xeyirli biri - Allahın elçisi - edib…"[906] Bunu Abdullah bin Ömər'dən oğlu Səlim, azadlı köləsi Nafi, həmçinin Urva bin əz-Zubeyr və Abdullah bin Əbi Muleykə rəvayət edir.[907] Ömər bunu ölüm ayağında yaralı ikən deyir,

---

903 "Tərixu Bağdad", 14/524; "Tərixu Diməşq", 50/366; "Vafiyətul-Ayən", 4/130; "Siyər Aləm ən-Nubələ", 13/228;

904 "Tərixu Bağdad", 13/421; "Siyər Aləmin-Nubələ", 11/47;

905 "Sahih əl-Buxari", 4447;

906 "Sahih əl-Buxari", 7218;

907 Əbu Davud "əs-Sünən" kitabında (2939) bunu şeyxləri Muhəmməd bin Davud bin Sufyən və Sələmə bin Şəbib ən-Nisəburi vasitəsi ilə Abdurrazzəq əs-Sanani'dən, o da Məmər bin Raşid'dən, o da əz-Zuhri'dən, o isə Səlim bin Abdilləh'dən, o da atası İbn Ömər'dən rəvayət edir. İmam Muslim də "əs-Sahih" kitabında (1823) bunu dörd şeyxindən; İshaq bin İbrahim, İbn Əbi Umeyr, Muhəmməd bin Rafi və Abd bin Humeyd'dən, onlar da

artıq öləcəyini bildiyi halda bu sözlərini ifadə edir. Ölümə bu qədər yaxın olan bir məqamda ona verilmiş suala verdiyi cavab bir daha göstərir ki, o, peyğəmbərin - aleyhissalətu vassələm - özündən sonra kimisə təyin etdiyinə inanmırdı. Bu həmçinin Əlidən gələn xəbərlərlə də tamamilə uyğun gəlir. Amr bin Sufyan deyir: "Əli əl-Cəməl günü insanların qarşısına (xütbə verərək) çıxdığında dedi: "Ey insanlar, Allahın elçisi - salləllahu aleyhi va səlləm - bu əmirlik işində bizə heç bir əhd buraxmadı, hətta özümüz rəyə əsasən ondan sonra Əbu Bəkri xəlifə seçdik."[908] Bir başqa rəvayətdə Əbu Bəkr əl-Huzəli bunu əl-Həsən'dən rəvayət edir: "Abdullah bin əl-Kəvva və Qeys bin Abbad Cəməl döyüşündən sonra Əli bin Əbi Talib'in yanına daxil oldular və ona dedilər: "Sənin tutduğun bu yol haqqında bizə xəbər ver; ümmətin parçalandıqda, çağırışlarda ixtilaf çıxdıqda öz rəyinə əsasən bu işdə insanların ən haqlı olduğunu düşündün? Əgər öz rəyindirsə sənin bu rəyinə icabət edərik. Yox əgər Allahın elçisinin - salləllahu aleyhi va səlləm - sənə əhd etdiyi bir əhddirsə, biz sənin peyğəmbərdən rəvayət etdiyində sənə etibar edirik." Dedi: "Əli şəhadət gətirdi və sonra dedi: "Allahın elçisindən - salləllahu aleyhi va səlləm - bu barədə məndə bir əhdin olmasına gəldikdə Allaha and olsun ki, xeyr, elə bir şey yoxdur. Əgər məndə Allahın elçisindən - salləllahu aleyhi va səlləm - bir əhd olsaydı heç cür Teym bin Murra'nın qardaşını, nə də əl-Xattab'ın oğlunu onun minbəri üstündə durmağa imkan verməzdim…"[909] Buna yaxın bir mənanı Abdurrazzəq əs-Sanani şeyxi Məmər vasitəsi ilə Əli bin Zeyd'dən, o da əl-Həsən əl-Basri'dən rəvayət edir. Bunu həmçinin

---

Abdurrazzəq əs-Sanani'dən eyni isnad ilə rəvayət edirlər. Əbu Avanə bu rəvayəti əz-Zuhri'dən həm də Saleh bin Keysən, Şueyb bin Əbi Həmzə, İshaq bin Raşid vasitəsilə də rəvayət edir. İbn Sad isə "ət-Tabəqat əl-Kubra" kitabında (3/343; əs-Sadir) bunu Arim bin əl-Fədl'dən, o, Həmməd bin Zeyd'dən, o Əyyub əs-Sixtiyəni'dən, o isə Abdullah bin Əbi Muleykə vasitəsilə İbn Ömər'dən rəvayət edir. Bunun İbn Ömər'dən gələn ən məşhur isnadı isə Hişəm bin Urva'nın öz atası Urva bin əz-Zubeyr'dən, onun isə İbn Ömər'dən rəvayət etməsi ilə tanınır. Əhməd bin Hənbəl bunu şeyxi Muhəmməd bin Bişr vasitəsilə Hişəm'dən, əl-Buxari isə Muhəmməd bin Yusuf əl-Firyəbi'dən, o isə Sufyan əs-Səvri'dən, o da Hişəm bin Urva'dan rəvayət edir. Muslim isə bunu şeyxi Əbu Kureyb Muhəmməd bin əl-Alə'dən, o da Əbu Usəmə'dən, o isə Hişəm bin Urva'dan rəvayət edir. Bunu İbn Ömər'dən həmçinin Muhəmməd bin Kəb əl-Qurazi, ondan da Ğufra'nın azadlı köləsi Ömər bin Abdilləh əl-Mədəni rəvayət edir. əl-Hakim bu isnadı "əl-Mustədrak" kitabında (rəq: 4576; ər-Risələ) gətirir. Ömərin bu sözlərini həmçinin İbn Abbas rəvayət edir; ondan bunu Humeyd bin Abdirrahmən əl-Himyəri, ondan Davud bin Abdilləh əl-Əvdi, ondan isə Əbu Avanə rəvayət edir. Bax: "Musnəd Əbi Davud ət-Tayəlisi", 1/30, rəq: 26

908 "İləl əd-Dəraqutni", 4/86; əl-Beyhəqi, "Dəlail ən-Nubuvva", 7/223; əz-Zəhəbi "Siyər Əaləm ən-Nubələ" kitabında (2/485; ər-Risələ) isnadının həsən olduğunu yazır.

909 əl-Acurri, "əş-Şəriah", 4/1723, rəq: 1194;

Abdullah bin Əhməd atasının "əl-Musnəd" kitabında İsmail Əbu Mə'mər'dən, o İsmail İbn Uleyyə'dən, o Yunus bin Ubeyd'dən, o da əl-Həsən əl-Basri'dən rəvayət edir.[910] Talha əl-Yəmi deyir: "Abdullah bin Əbi Əvfə'dən soruşdum: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəsiyyət etdimi?" Dedi: "Xeyr." Soruşdum: "Özü vəsiyyət etmədiyi halda bizə niyə vəsiyyət etməyi əmr etdi?" Dedi: "O, Allahın Kitabını vəsiyyət etdi."[911] Abdullah bin Abbas deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - heç bir vəsiyyət etmədən öldü."[912]

Üstəlik bu məqamda belə bir sual verilməlidir. Əgər səhabələr peyğəmbərin əhdinə bilərək xəyanət etdilərsə, dinin əslini inkar etdilərsə o zaman ya mürtəd, ya da fasiq oldular. Dörd və ya yeddisindən və ya on ikisindən başqa yerdə qalan on minlərlə səhabə mömin adını itirmiş olmalı idi. Şiə alimlərinin inancı onsuz da bunu iddia edir. Şiə alimlərindən Əli ən-Nəmazi əş-Şəhrudi yazır: "Peyğəmbərdən - salləllahu aleyhi və alih - sonra üç və ya dörd nəfər istisna olmaqla qalanların mürtəd olduğunu söyləyən çoxsaylı xəbərlərə görə, Peyğəmbərin - salləllahu aleyhi və alih - dövründə şəhid olmamış, ondan sonra sağ qalmış hər bir səhabədə əsli hal onun mürtəd olmasıdır, çünki vilayət barəsində açıq-aşkar təyin olunmuş şəxsin yerinə təyin olunmamış birini qabağa çəkiblər. Yaxud da onun haqqında təqsirə yol verdiyi üçün fasiqdir. Buna görə də istisna olunmuş şəxslərdən başqa qalanların etibarlı hesab olunması ancaq şəri bir dəlillə mümkündür."[913] Beləliklə də aydın olur ki, barmaqla sayılacaq şəxslər istisna olmaqla hər kəs ya mürtəd, ya da fasiq idi. O zaman bu xəyanətlərə, küfrə və fisqə rağmən Əli bin Əbi Talib'in - kərraməllahu vachəhu - ilahi bir müdaxilə ilə bir xəlifə, imam və əmir olacağını fərz etmiş olsaq, Əli necə bir qövmün əmiri olacaqdı?! Şiə alimi Şeyx Muhəmməd Həsən ən-Nəcəfi yazır: "**Ağla belə bir fikir gəlir ki, Əli - aleyhissələm - üçün öz xüsusi şiələri istisna olmaqla, hər kəsi öldürmək caiz idi, çünki Səqifə günü dörd nəfərdən, Salman, Əbu Zər, Miqdad və Ammardan savayı bütün insanlar Rəsulullahdan - salləllahu aleyhi va əlihi - sonra**

---

[910] "Musnəd Əhməd", 2/417, rəq: 1271; ər-Risələ çapı. Şeyx Şueyb isnadının səhih olduğunu yazır.

[911] "Musnəd Əbi Davud ət-Tayəlisi", 2/162, rəq: 859; "Musnəd əl-Humeydi", 1/571, rəq: 739;

[912] "Musnəd Əhməd", 5/267, rəq: 3189; ər-Risələ çapı. Şeyx Şueyb isnadının səhih olduğunu yazır.

[913] əş-Şəhrudi, "Mustədrakət İlm Ricəl əl-Hədis", 1/67;

**mürtəd olmuşdular. Daha sonra bəzi şəxslər doğru yola qayıtdılar, lakin Əbu Bəkr, Ömər və Osmanın dövrləri gəlib keçənə qədər insanların qalanları küfr üzərində qaldılar və küfr onlara tam hakim oldu. Nəhayət iş (xilafət) Əliyə - aleyhissalam - gəlib keçdi. Lakin onların arasında haqqı bərqərar etmək üçün onları bir-birinə vurmaqdan başqa yolu yox idi; onlardan hər kimi öldürdüysə ona halal idi. Burada onun xüsusi şiələri istisnadır, çünki o, təkcə onların vasitəsilə haqqı bərqərar etməyə qadir deyildi.**"[914] Bu şiə aliminin sözləri doğrudursa belə çıxır ki, Əli xəlifə olduqda onun idarəsi altında olan insanlardan barmaq sayı istisna hamısı kafir və ya münafiq idilər. Məgər belə bir qövmün üzərinə xəlifə və əmir olaraq gəldikdə onun üçün "əmirul-muminin", yəni "möminlərin əmiri" demək nə qədər məntiqli olacaq?! Bəlkə "əmirul-kuffar val-fasiqin", yəni kafirlərin və fasiqlərin əmiri və ya "əmirul-murtəddin", yəni mürtədlərin əmiri olmalı idi?! Əhlüs-sünnətin etiqadına əsasən səhabələr bir kollektiv olaraq peyğəmbərin - aleyhissələm - əhdinə xəyanət etməmişdilər, əksinə mömin adına ən layiq olan şəxslər olmağa davam etdilər. Ona görə də bizim nəzərimizdə Əbu Bəkri, Ömər, Osmanı, həmçinin Əlini "əmirul-muminin" adlandırmaq tam yerinə oturur. Lakin şiələrin iddiası doğrudursa belə bir ləqəbin reallıqdan heç bir payı qalmır.

Şiə məzhəbinin iddiaları ilə ziddiyyət içində olan tarixi həqiqətlərdən biri də Peyğəmbərimizin – aleyhissələm – vida həccində insanlara verdiyi xütbədə onlaran tələb etdiyi şahidlikdir. Beləki Peyğəmbər – salləllahu aleyhi va səlləm – vida həccində onminlərlə insanın hüzurunda verdiyi xütbədə onlara bəzi tövsiyələr etmiş, axırda isə onlardan soruşmuşdu: "Sizə Allahın buyurduqlarını çatdırdımmı?" Onlar da hamılıqla çatdırdığına dair şahidlik edirlər. Sonra rasulullah əlini səmaya qaldırır və üç dəfə deyir: "Allahım, şahid ol!" Bu hədisi Əbu Said əl-Xudri Cabir bin Abdilləh, Nubeyt bin Şərit, əl-Adə bin Xalid əl-Kiləbi, Əbu Bəkra, Əbu Ğadiyə, Amr bin əl-Əhvas, Abdullah bin Ömər, Ummu Husayn, Vasibə bin Mədəb və başqaları mütəvatir olaraq rəvayət edirlər.[915] Yenə səhih hədislərdə sabit olub ki, bu vida

---

[914] ən-Nəcəfi, "Cəvahirul-Kələm", 21/347;

[915] Əbu Said əl-Xudri'nin rəvayətini İmam Əhməd "əl-Musnəd" (18/286, rəq: 11762) kitabında, Cabir bin Abdilləh'in rəvayətini İmam Muslim "əs-Sahih" kitabında (1218), Nubeyt bin Şərit'in şahidliyini İmam Əhməd "əl-Musnəd" kitabında (20/31, rəq: 18722), əl-Adə əl-Kiləbi'nin xəbərini yenə Əhməd kitabında (33/447, rəq: 20336), Əbu Bəkra'nın rəvayətini Əhməd "əl-Musnəd"də (34/48, rəq: 20407), Əbu Ğadiyə'nin hədisini yenə Əhməd

həccində cümə günündə Arafədə bu ayə Peyğəmbərə nazil oldu: “Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və bir din olaraq sizin üçün İslamı bəyənib seçdim.”[5:3] Beləliklə də Allahın elçisi – aleyhissələm – müsəlmanları şahid tutaraq risaləti təbliğ etdiyini elan etdi və Mövlası ona dini kamil etdiyinə və onu tamamladığına dair ayə endirdi. Əgər şiələrin iddiası doğrudursa o zaman bu mütəvatir xəbərdə Allahın elçisinin iddiası doğru çıxmır, çünki ğadir xum hadisəsi bundan sonra olub. Allahın elçisi – aleyhissalətu vassələm – Əlinin vilayətini təbliğ etmədən əvvəl necə insanları Allah qarşısında, Allahı isə insanların qarşısında şahid tutaraq risaləti təbliğ etdiyini deyə bilər?! Əgər şiələrin iddiası doğrudursa o zaman Allahın elçisi – aleyhissələm – vida həccində insanları şahid tutarkən doğru danışmırdı, çünki hələ də insanlara – şiələrin iddiasına görə - dinin ən əzəmətli rüknunu təbliğ etməmişdi.

Şiə qardaşlarımızı öz ittihamlarının ağır nəticələri üzərində düşünməyə dəvət edirəm. Əgər səhabələr – şiələrin iddia etdikləri kimi – peyğəmbərin son əhdinə, dinin ən ağır rüknuna xəyanət ediblərsə, ən son məqamda ümmətin islahı üçün zəruri olan imamət əsasını alt-üst ediblərsə və bunu edərkən qəsdən Allahın və rasulunun əmrinə müxalif olublarsa, məgər bu o anlama gəlmirmi ki, peyğəmbər – aleyhissələm – bir mürəbbi kimi keyfiyyətsiz olub?! Haşa! İnsan bu sözləri yazmağa həya edir, amma düşüncəniz ittihamın əslində Peyğəmbərin özünə yönəldiyini dərk etmiş olarsız. Çünki “imaməti qəsb” etməkdə ittiham olunanların başında Əbu Bəkr və Ömər gəlirsə özlüyündə onların kim olmaqları barəsində düşünməyimiz lazım deyilmi? Əbu Bəkrin məgər Peyğəmbərin dəstəyi və təqdiri olmadan Əbu Bəkr olması mümkün idimi? Teym oğulları kimi zəif bir qəbilədən çıxmasına baxmayaraq onu müsəlmanların gözündə məqamını qaldıran məgər Allahın elçisinin – salləllahu aleyhi va səlləm – özü olmadımı? Hicrət edərkən onu özünə yol yoldaşı seçdi, hicrətdən sonra qızını alaraq onunla yaxın qohumluq bağı qurdu, dəfələrlə önəmli məqamlarda onunla məsləhətləşdi, Məkkənin fəthindən sonra göndərdiyi həcc qafiləsinə onu əmir təyin etdi, xəstə ikən müsəlmanlara namaz qılmaq üçün imam seçdi. Bütün bunları etməklə Allahın elçisi – salləllahu aleyhi va səlləm – Əbu Bəkri insanların

---

“əl-Musnəd” kitabında (34/264-265, rəq: 20666), Abdullah bin Ömər’in şahidliyini əl-Buxari “əs-Sahih” kitabında (1742), Ummu Huseyn’in rəvayətini əl-Fəkihi ”Əxbəru Məkkə” kitabında (2635), Vasibə bin Mədəb’in rəvayətini isə İbn Əbi Asim “əs-Sunən” kitabında (1052) rəvayət edirlər.

gözündə Əbu Bəkr etdi, müsəlmanların nəzərində onun dəyərini yüksəltdi, yerini bərkitdi və ona ad qazandırdı. Bütün bunlardan sonra Peyğəmbər – aleyhissələm – vəfat etdikdə müsəlmanlar onu özlərinə imam seçdilərsə bunun hamıdan qabaq əsas səbəbkarı Peyğəmbər özü olub. Dünya liderlərindən hər kim öz qoynunda bir xəyanətkarı bəsləmiş olsa onu bəsirətsiz adlandırarlar. Biz isə Allahın Peyğəmbərindən – aleyhissalətu vassələm – danışırıq; onun bu şəkildə xəbərsiz bir şəkildə öz qoynunda xəyanətkar yetişdirməsi imkansız bir şeydir, çünki Allahın – təbərakə va təalə - Peyğəmbərinə ümmətinin aqibətini xəbər verdiyini gözəl bilirik. Ölümündən sonra baş verəcək fitnələri də qabaqcadan xəbər verməsi, bununla bağlı bizi xəbərdar etməsi bizə məlumdur. Bütün bunlara baxmayaraq Allahın elçisi – aleyhissələm – Əbu Bəkri və Öməri öz yanından uzaqlaşdırmayıbsa, onların məqamını müsəlmanların nəzərində möhkəmləndiribsə burdan nə nəticə çıxara bilərik? Üstəlik vəfatından sonra Əbu Bəkri onun xəlifəsi olaraq seçib beyət edən ümməti yetişdirən, onları tərbiyə edən də yenə Allahın rasulunun – aleyhissələm – özü olub. Necə ola bilər ki, həyat yoldaşlarından tutmuş ən yaxın silahdaşlarına qədər hamı onun əhdinə xəyanət edib ondan üz döndərib? Tarixdə görəsən hansı peyğəmbər bu dərəcədə uğursuzluq yaşayıb? Bütün bunlarla yanaşı Allah – cəllə cələluhu – onlar haqqında buyurur ki, "siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz."[3:110] Belə bir şey məquldurmu? Şiə qardaşlarımız dərk etməlidirlər ki, onlar səhabələri ittiham etməklə Allahın elçisini də - salləllahu aleyhi va səlləm – ittiham etmiş olurlar.

Burada düşünməyimiz lazım olan daha bir nöqtə mövcuddur. Əgər Allah elçisinin – aleyhissələm – qəsdi özündən sonra xəlifə təyin etmək idisə nə üçün bunun üçün tələb olunan heç bir icraatı etməyib? Misal üçün a) Mədinədə ən böyük qrup olan ənsarlara açıq-aşkar təlimət verməyib, çünki peyğəmbərin vəfatı halında bu iş yalnız ənsarların razılığı ilə alına bilərdi. Mənzilə hədisi Tabuk döyüşündə baş vermişdi və Tabuk döyüşündən sonra fərqli qəbilələrdən yetmişdən çox nümayəndə gəlib peyğəmbərə beyət etmişdi, b) əgər peyğəmbər özündən sonra Əlini xəlifə təyin etmək istəyirdisə nə üçün həmin nümayəndəliklərdən özü üçün beyət aldığı kimi həm də Əli üçün vəliyyul-əhd olaraq beyət almamışdır? Əgər belə etsəydi imamət qarantiya altına alınmayacaqdımı? Üstəlik peyğəmbər – aleyhissələm – xəstələndikdə və hətta xəstələnmədən əvvəl c) nə üçün bəzi vəzifələri Əliyə tapşırmadı? Misal üçün Usamə ordusunun göndərilmə işini Əliyə

tapşıra bilərdi, yaxud da camaat namazında Əlini imam təyin edə bilərdi, ümumiyyətlə xəstəliyində insanların ibadətləri və dünyəvi işlərində müraciət etmələri üçün Əlini hakim təyin edə bilərdi və ya digər vəzifələri ona tərk edə bilərdi. Lakin bunların heç birini etməyib. Vəfat etmədən əvvəl d) İslamı qəbul etmiş qəbilələrə açıq dildə, aydın göstəriş ilə məktub yaza bilərdi, lakin yazmadı. Halbuki qəbilələrə, İslam dövlətinin müxtəlif bölgələrinə zəkatla və digər administrativ işlərlə bağlı məktublar yazdırıb göndərdiyini bilirik. Bu barədə misal üçün "Allahın rasulu – salləllahu aleyhi va səlləm - Yəmən əhlinə içində fərzlər, sünnətlər və diyətlər olan bir məktub yazdı və onu Amr bin Həzm ilə göndərdi."[916] Həmçinin Əşyəm əd-Dibəbi qətl edildikdə onun zövcəsinin qan puluna varis olacağına dair Allahın elçisinin – salləllahu aleyhi va səlləm - əd-Dahhək bin Sufyana bir məktub göndərdiyini də bilirik.[917] Burada ölü heyvanın dərisindən və ya hansısa bir hissəsindən istifadə etməyin qadağan olunması barədə Allahın elçisinin – aleyhissalətu vassələm – Abdullah bin Ukeym'ə göndərdiyi məktubu da göstərmək olar.[918] Haram bölgəsinin ağaclarını qoparmağın və heyvanlarını ovlamağın qadağan olması ilə bağlı Səqifdəki müsəlmanlara Xalid bin Said bin əl-As'ın əli ilə bir məktub yazıb.[919] Allahın elçisinin – salləllahu aleyhi va səlləm – yazdırdığı bu məktublar qeyd etdiklərimizdən daha çoxdur və bu barədə qaynaqlarda kifayət qədər məlumat var. Xəlifələrin dönəmində və onlardan sonra səhabələr və tələbələri bu məktublara müraciət edir və ondan istifadə edirdilər. Əgər Allahın elçisi zəkat, qan pulu, ölü heyvanın dərisi kimi məsələlərdə məktub yazmağı önəmli hesab edibsə görəsən nə üçün bu qədər önəmli və əhəmiyyətli bir işdə öz valilərinə, müxtəlif qəbilə başçılarına bu cür məktublar göndərməyib? Yaxud da onları öz yanına çağıraraq onlardan xüsusi bir şəkildə beyət ala bilərdi. Bizə məlumdur ki, Məkkəyə doğru yürüş etmək istədiyində Allahın elçisi – aleyhissələm – bütün qəbilələrə xəbər göndərib onlara "Allaha və Axirət gününə iman edənlər ramazan ayında Mədinəyə gəlsinlər"[920] deyərək bir

---

[916] İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 1/366; ən-Nəsai, "əs-Sunən əl-Kubra", 6/373 (7029) ər-Risələ çapı.
[917] əş-Şafi, "əl-Umm", 6/95; ət-Tabərani, "əl-Mucəm əl-Kəbir", 5/276 (5315); "Sunən əd-Dəraqutni", 5/133
[918] "Musnəd Əbi Davud ət-Tayəlisi", 2/623 (1389); "Musannəf Abdirrazzəq", 1/65 (202) əl-Azami çapı.
[919] "Siratu İbn Hişəm", 2/542-543; Əbu Ubeyd, "əl-Əmval", səh: 250; İbn Sad, "ət-Tabəqat əl-Kubra", 1/285, Dar Sadir.
[920] "İmtə əl-Əsmə", 1/354; "Subul əl-Hudə var-Raşəd", 5/211; "əd-Sira əl-Hələbiyyə", 3/107;

tapşırıq vermişdi. Ramazan ayında hamı toplaşdıqda Məkkəyə yürüş etdilər. Əgər şiələrin iddia etdikləri kimi imamət məqamı nübuvvət məqamının əkizi olacaq qədər əhəmiyyətlidirsə nə üçün Məkkənin fəthinə verilən önəm qədər buna da önəm verilmədi? Necə olur ki, Məkkəni fəth etməyə hazırlaşarkən casus əməliyyatlarına qarşı tədbir gördüyü halda, e) özündən sonrakı xəlifəyə qarşı üsyan və xəyanət edilməsin deyə heç bir tədbir görmədi?! Həmçinin f) öz ailə üzvlərini, həyat yoldaşlarını yığıb onlara xüsusi göstəriş nə üçün vermədi? Nə üçün xanımlarına, ona xidmət etmiş Ənəs bin Malik, Abdullah bin Abbas kimi səhabələrə ondan sonrakı xəlifəyə möhkəm şəkildə sarılmağı, ona dəstək olmağı vəzifələndirmədi?

Əgər səhabələr həqiqətən də peyğəmbərin – aleyhissalətu vassələm - əhdinə xəyanət etmiş bir nəsil idisə necə olur ki, iddia olunan bu xəyanətin başında duran Əbu Bəkr bütün çətinliklərə və risklərə baxmayaraq Usəmə bin Zeydin ordusunu göndərmək əmrini israrla infaz etdi?! ət-Təbəri yazır ki, "Əbu Bəkr – radiyallahu anhu – xilafətə seçildikdən sonra, ənsarlarla aralarında baş vermiş ixtilafı aradan qaldıraraq onları bir yerə topladı. Daha sonra dedi: "Usamə ordusu mütləq göndəriləcək!" Halbuki bu vaxt ərəblərdən bəziləri tamailə, bəziləri isə hər qəbilədə qismət mürtəd olmuşdu. Nifaq boy göstərmiş, yəhudilər və xristianlar baş qaldırmağa başlamışdı. Müsəlmanlar isə yağışlı və soyuq bir gecədəki qorxmuş sürü kimi qalmışdılar – çünki Peyğəmbər – salləllahu aleyhi va səlləm – artıq vəfat etmişdi, sayları az, düşmənləri isə çox idi. İnsanlar ona dedilər: "Bu orduda olanlar müsəlmanların böyük bir qismini təşkil edir. Sənin də gördüyün kimi, ərəblər sənin ətrafından dağılmış vəziyyətdədir. Belə bir halda müsəlmanların cəmləndiyi qüvvəni özündən ayırmağın doğru deyil!" Lakin Əbu Bəkr dedi: "Canım əlində olan Allaha and olsun ki, əgər vəhşi heyvanların məni didib-parçalayacağını güman etsəydim belə, yenə də Allahın elçisinin – salləllahu aleyhi va səlləm – göndərilməsini əmr etdiyi Usamə ordusunu mütləq göndərərdim. Əgər şəhərlərdə məndən başqa heç kim qalmasa belə, onu yenə də göndərərdim!"[921] Ümumiyyətlə o zaman İslam cəmiyyətinin varlığı real təhlükə altında qalmışdı, riddət hərəkatı müsəlmanların müqəddəratını ciddi risk altında qoymuşdu. Əbu Bəkr'in mübaliğə şəkildə dediyi sözlərdən də anlamaq olur ki, Mədinənin küçələrində müsəlmanların cəsədlərinin sərildiyi və yırtıcı heyvanların yeminə çevrildiyi bir səhnənin baş verməsi mümkün idi. Bütün bunlara baxmayaraq Əbu

[921] "Tarix ət-Təbəri", 3/225; İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 9/416 ət-Turki çapı.

Bəkr Allahın elçisinin – aleyhissalətu vassələm – verdiyi ən son göstərişə müxalif olmaqdan qorxdu və Usamə'nin ordusunu göndərdi. Qəlbində nifaq olan və Allahın göndərdiyi dinə inanmayan bir kimsə bu cür hərəkət edərdimi?! Bütün bunlar bizə bir daha isbat edir ki, ilk xəlifələr səmimi olaraq Allahın dininə xidmət ediblər və mümkün olduğu qədər müsəlmanların haqlarını qoruyublar. Hətta görkəmli şiə alimlərindən Muhəmməd əl-Hüseyn Al Kəşif əl-Ğita ilk iki xəlifənin ədalətini etiraf edərək yazır ki, Əli bin Əbi Talib "iki xəlifənin tövhid kəlməsini yaymaq, İslam ordusunu tə`sis və təchiz etmək, və fəth ərazilərini genişləndirmək üçün maksimum dərəcədə çalışdıqlarını, hakimiyyətdən sui-istifadə edib despotluq etmədiklərini gördükdə onlarla sülh içində yaşamağa qərar verdi və beyət etdi."[922] Əlavə edir: "O günlərdə şiələrin və şiəliyin zühur etməsi üçün macal yox idi, çünki İslam möhkəm metodlar üzərində davam edirdi…" Həmçinin Fədl bin Şazan'a nisbət edilən "əl-İydah" kitabında sünnilərə cavab verən müəllif[923] deyir: "Biz, sizin rafizilər adlandırdığınız şiələrin sizə yalnızca Əlini Əbu Bəkr və Ömərdən daha fəzilətli görməkdə müxalif olduqlarını görürük. Onlar Əbu Bəkr və Ömərin namazı tərk etdiklərini, zina və lutilik etdiklərini, içki içdiklərini, haramı və zülmü halal etdiklərini deməyiblər. Sadəcə olaraq deyiblər ki, Əli - aleyhissələm - o ikisindən və başqalarından daha əfzəldir…"[924] Əlbəttə ki, belə bir təsəvvür Əbu Bəkr və Ömər haqqında deyilənlərlə uyğun gəlmir. Onların həyatını, İslam dini üçün etdiklərini xidmətlərini yaxından incələyən kəs onlara qarşı yönəldilmiş ittihamların sadəcə iftira olduğunu dərk edəcək.

Ümumən səhabələr nə üçün bu qədər əziyyətdən, bu qədər risklərdən, fədakarlıqlardan sonra iddia olunan bu xəyanəti etsinlər?! Çünki həyatlarını bu din və bu dəvət üçün təhlükəyə atmış və Quranda Allah tərəfindən təriflənmiş bir qövmdən söhbət gedir. Ona görə də zeydi şiələrinin böyük alimlərindən olan Yəhya bin Həmzə əl-Ələvi qeyd edir ki, peyğəmbərin - salləllahu aleyhi va sələm - Əlini təyin edən "sözlərindəki qəsdini zəruri olaraq bilmiş olsaydılar ona müxalif olmaqları imkansız olardı; çünki biz zəruri olaraq onların Allahın elçisini - aleyhissalətu vassələm - şiddətli şəkildə sevdiklərini, onun əmrlərini və qadağalarını aşırı şəkildə ciddiyə aldıqlarını bilirik. Bu səbəblə onun üçün öz vətənlərini tərk etməyə, öldürülmək üçün ruhlarını fəda

---

922 Kəşif əl-Ğita, "Əsluş-Şiati va Usuluhə", səh: 123-124;

923 İddiaya görə bu müəllif əl-Fədl bin Şazan ən-Nisəburi'dir.

924 "əl-İydah", səh: 303;

etməyə, onun dininə dəstək məqsədilə öz qohumlarını öldürməyə, yaxşılığı əmr edib pisliklərdən çəkindirməkdə əziyyətlərdən keçməyə səbr etdilər. Bunların hamısı dəlalət edir ki, onlar bu dinin doğru olduğunu bilirdilər, ona tabe olmağın mükafatının cənnət, müxalif olmağın cəzasının isə ataş olduğuna etiqad edirdilər. Halı bu cür olan böyük bir topluluğun onun nə qəsd etdiyini zəruri olaraq bilib ona müxalif olması imkansızdır…”[925] Həqiqətən də bu məqamın üzərində düşündükdə şiələr tərəfindən canlandırılan mənzərə ciddi problemlərlə qarşılaşır, çünki böyük bir kütlənin bir din üçün bütün təhlükələrə qatlandıqdan, onun üçün vuruşub öldürdükdən, öldürüldükdən və yaralandıqdan sonra kollektiv şəkildə o dinə xəyanət etməsini insan əqli qəbul etmir. Səhabələr bu dünyanı Axirətə satmış insanlar idilər. Cəfər əs-Sadiq onlar haqqında belə bir şahidlik edir: “Allahın Rəsulunun - salləllahu aleyhi va əlihi - səhabələri on iki min nəfər idi: səkkiz min nəfər Mədinədən, iki min nəfər Məkkədən və iki min nəfər isə “*tuləqa*” arasından idi… Onlar gecə-gündüz ağlayırdılar və deyirdilər: “Bişmiş yumşaq çörək yemədən ruhlarımızı al, ey Allah!”[926] Hətta maraqlıdır ki, imami şiələrinin müasir alimlərindən Əbul-Qasim əl-Xoyi səhabələrin Quranın təhrif olunmasına imkan verə bilməyəcəklərini izah edərkən bu sözləri deyir: “Səhabələrin Peyğəmbər – sallallahu aleyhi və alih – dövründə və onun vəfatından sonra Qurana olan bu qədər diqqət və qayğı göstərməsi bizə qəti şəkildə göstərir ki, Quran onların yanında ya toplanmış şəkildə, ya da parça-parça, ya sinələrdə qorunaraq, ya da yazılı vərəqlərdə saxlanılaraq mühafizə olunmuşdur. Onlar cahiliyyət dövrünün şeirlərini və xütbələrini belə qoruyub saxlamışkən, necə ola bilər ki, bu qədər fədakarlıqla dəvət etdikləri, hökm və qanunlarını elan etdikləri, onun yolunda canlarını təhlükəyə atdıqları, vətənlərini tərk etdikləri, mallarını fəda etdikləri, qadınlarından və uşaqlarından üz döndərdikləri və tarixə şərəf gətirəcək mövqelər sərgilədikləri halda, Allahın bu müqəddəs kitabına – Qurana – etinasız yanaşmış olsunlar?! Belə bir şeyi ağlı başında olan bir insan düşünə bilərmi?!”[927] Xeyr, əlbəttə ki, düşünə bilməz! Eyni şəkildə Allahın elçisinin - aleyhissalətu vassələm - özündən sonra bir xəlifə təyin etdiyini bildikləri halda bütün bu fədakarlıqlardan, əziyyətlərdən

---

[925] əl-Ələvi, “ət-Təmhid fi Şərh Məalim əl-Adl vat-Təvhid”, səh: 588;

[926] əs-Saduq, “əl-Xisal”, səh: 639-640; əs-Saduq bunu Əhməd bin Ziyad bin Cəfər əl-Həmədəni’dən, o da Əli bin İbrahim əl-Qummi’dən, o isə atası İbrahim bin Haşim’dən, o da Muhəmməd bin Əbi Umeyr’dən, o Hişəm bin Səlim’dən, o da İmam əs-Sadiq’dən rəvayət edir. Şiə ricəl alimlərinə görə ravilərin hamısı siqadır.

[927] əl-Xoyi, “əl-Bəyan fi Təfsir əl-Quran”, səh: 216;

və qurbanlardan sonra məqsədli şəkildə xəyanət etmələri də imkansızdır.

Lakin şiə alimləri bununla belə səhabələrin məqsədli şəkildə xəyanət etdiklərini iddia edirlər. O zaman iddia olunan bu xəyanətin çox tutarlı bir səbəbi olmalıdır. Şeyxut-Taifə ət-Tusi bu suala belə cavab verir ki, onlar hakimiyyətə rəğbət bəsləyirdilər, üstəlik Əliyə qarşı həsəd və düşmənçilik var idi, çünki Əli onların qohumlarından çoxunu öldürmüşdü.[928] Həmçinin əl-Məzəndərani səhabələrin "həsəd, inad və düşmənçilik" səbəbi ilə Əliyə qarşı çıxdıqlarını yazır, "çünki o - aleyhissələm - onların övladlarından, atalarından və böyüklərindən çox sayda insan öldürmüşdü.."[929] Həmçinin "Uyun Əxbər ər-Rida" kitabında İmam Əli ər-Rida'ya nisbət edilən bir xəbərdə ondan soruşurlar: "Möminlərin əmiri Əlinin fəzilətini, müsəlmanlığı qəbul etmiş ilk şəxs olduğunu və Allahın elçisinə - salləllahu aleyhi va əlihi - yaxınlığını bildikləri halda insanlar necə onu tərk edib başqasına yönəldilər?" Dedi: "Onun fəzilətini bildikləri halda onu tərk etməklərinin yeganə səbəbi bu idi ki, o, onların atalarından, babalarından, qardaşlarından, əmilərindən, dayılarından və qohumlarından Allaha və elçisinə düşmənlik etmiş çox sayda insan öldürmüşdü. Qəlblərindəki nifrətin səbəbi bu idi, ona görə də onların başına keçməsini istəməmişdilər."[930] Beləliklə də burada əsasən iki səbəb gətirilir. Birincisi hakimiyyətə olan rəğbət, ikincisi isə qan davası göstərilir. Əslində səhabələr ilə Əlinin arasındakı bu ədavəti isbat etmək üçün qarşıya qoyulan dəlillərin heç bir elmi dəyəri yoxdur. Misal üçün buveyhi dövlətində vəzir olaraq çalışmış Əbu Sad əl-Əbbi "Nəsrud-Durr" kitabında heç bir isnad zikr etmədən İbn Abbasın adından nəql edir ki, guya Osman Əliyə deyib: "Qureyş sizi sevmirsə mən sizin üçün nə edə bilərəm ki? Onlardan Bədr günü yetmiş nəfəri öldürmüsüz…"[931] İbn Əbil-Hədid "Nəhcul-Bəlağa" kitabının şərhində Qureyşin Əliyə nifrət etdiyini göstərmək üçün bu rəvayəti zikr edir.[932] Belə çıxır ki, qureyş Bədr meydanında ölənlərə görə Əli və ailəsinə nifrət edirdi. Maraqlıdır ki, Bədrdə öldürülən qureyşlilərin tamamı yetmiş nəfər idi, məgər onların hamısını Əli və ailəsi öldürmüşdü?! O meydanda vuruşan digər səhabələr kimisə öldürməyi

---

[928] ət-Tusi, "Məsələtun Uxra fin-Nassi alə Ali", səh: 29;

[929] "Şərh Usul əl-Kəfi", 6/119;

[930] "Uyun Əxbər ər-Rida", 1/87;

[931] əl-Əbbi, "Nəsrud-Durri fil-Muhadarat", 2/48; Darul-Kutubil-İlmiyyə

[932] İbn Əbil-Hədid, "Şərh Nəhcil-Bəlağa", 9/23;

bacarmamışdılar?! Dəlil olaraq gətirilən başqa bir rəvayətdə isə İbn Abbasın tələbəsi Tavus deyir: "Əli bin Hüseyn bin Əli'yə dedim: "Qureyşin Əlini sevməməyinin səbəbi nədir?" Dedi: "Çünki o, onlardan öldürdüklərini atəşə göndərdi, sağ qalanlarına isə utanc verdi."[933] Rəvayətin isnad baxımından xeyli etibarsız[934] olmasından əlavə mənası da tutarsızdır, çünki qureyşin müşriklərini öldürən təkcə Əli olmayıb, digər səhabələrin də payı olub. Şiə alimi Qutbuddin ər-Rəvəndi "şiqşiqiyyə" xütbəsini şərh edərkən orada keçən və Əlinin dediyi iddia olunan "onlardan kimisi nifrətinə görə (mənə qarşı) meyl etdi" sözləri haqqında deyir ki, "bununla Sad bin Əbi Vaqqas'ı qəsd edir, çünki Əli - aleyhissələm - Bədr günü onun atasını öldürmüşdü. İbn Əbil-Hədid düzəliş edir: "Bu xətadır, çünki onun atası Əbu Vaqqas'dır və adı Malik bin Uheyyib bin Abdi Mənaf… dır, cahiliyyə zamanı ölüb…"[935] Beləliklə şiə alimləri hələ də Əlinin məşhur mühacirlərdən kimin atasını və oğlunu öldürdüyünü müəyyən etməkdə çətinlik çəkirlər. ər-Rəvəndi'nin dedikləri şiələrdə məşhurdur. əş-Şərif əl-Murtəda deyir: "Və ona qarşı kin bəsləyərək (Osman) meyl edən şəxs isə Səd ibn Əbi Vəqqas Zühri idi. O, möminlərin əmirinə - əleyhis-salam - qarşı münhərif idi və onun vilayəti zamanı beyət etməkdən imtina edənlərdən biri idi."[936] Münhərif olmaq o deməkdir ki, Sadın qəlbində Əliyə qarşı kin var idi, onun haqqında çox pis fikirdə olub. İşin qəribəliyinə baxın! Əlinin fəzilətlərini ən çox rəvayət edənlərin arasında Sad bin Əbi Vaqqas xüsusi seçilir. Ğadir hədisini, Mənzilə hədisini, Xeybərdə sancaq hədisini, Mübahələ hədisini rəvayət edənlərdəndir. Mənzilə hədisini ondan övladlarından beş nəfər, Musab, Amir, İbrahim, Muhəmməd və Aişə rəvayət edib. Müaviyənin hüzurunda Əlinin söyülməsinə qarşı etirazını dilə gətirən və onun fəzilətini xatırladan da odur. Amma bununla belə Sadı insanlara Əlinin düşməni kimi təqdim etməyi bacarıblar.

Əlinin - kərraməllahu vachəhu - Bədr döyüşündə öldürdüyü müşriklərin arasında Talha bin Əbi Talha, əl-Valid bin Utbə bin Rabia, Amir bin Abdilləh ən-Nimri, peyğəmbərimizin qaynı Nəvfəl bin Xuveylid bin Əsəd, Məsud bin Əbi Umeyyə bin əl-Muğira, Abdullah

---

[933] İbn əl-Aərabi, "Mucəm əş-Şuyux", 1/300 (573)

[934] İsnadındakı Muhəmməd bin Zəkəriyya bin Dinar əl-Ğalləbi tərk olunmuş yalançı bir ravidir. İbn Main və əd-Dəraqutni onun hədis uydurduğunu deyiblər, əz-Zəhəbi yalançı olduğunu yazıb.

[935] İbn Əbil-Hədid, "Şərh Nəhc əl-Bələğa", 1/189;

[936] "Rasəil əş-Şərif əl-Murtəda", 2/111;

bin Əbi Rifəə, Həcib bin əs-Səib bin Uveymir, əl-As bin Munəbbəh bin əl-Həccəc'ın olduğunu bilirik. Uhud döyüşündə Əbul-Həkəm bin əl-Əxnəs bin Şəriq, Umeyyə bin Əbi Huzeyfə bin əl-Muğira'nı, Xəndək döyüşündə Amr bin Abd bin Əbi Qeyd bin Abdivudd'u öldürüb. Sira və məğazi kitablarında bəzi şəxslərin Əli yoxsa başqa səhabələr tərəfindən öldürülməsi mübahisəli olan şəxslərin də adları keçməkdədir. Bunların arasında Hanzala bin Əbi Sufyan bin Hərb, Zeyd bin Muleys, Umeyr bin Osman bin Amr bin Kəb, Nubeyh bin əl-Həccəc bin Amir, Muaviyə bin Amr bin Luey, Hərmələ bin Amr əl-Əsədi, Əbul-As bin Qeys bin Adiy, əl-As bin Said bin əl-As və başqalarının adları sadalanır. Əlinin öldürdükləri arasında əl-Miqdad bin Amr tərəfindən əsir götürülmüş və peyğəmbərin - salləllahu aleyhi va səlləm - əmri ilə edam edilmiş ən-Nədr bin əl-Həris bin Kələdə var.[937] Əsir götürülüb edam edilənlər arasında Tueymə bin Adiyy bin Nəufəl də olub, lakin onu edənin Əli yoxsa Həmzə olması ixtilaflıdır.[938] İstənilən halda adlarını saydığımız bu şəxslər mühacirlər və ənsar arasında sözü keçən səhabələrin ataları, qardaşları və əmiləri olmayıblar. Ona görə də Heydər Əli Qələmdəran yazır: "Bəzi (şiə) alimlər bu problemi həll etməyə və səhabələrin Əlini imamətdən kənarlaşdırılmasına bir izah gətirməyə çalışarkən iddia ediblər ki, bunun səbəbi Əlinin, xüsusilə də İslamın erkən döyüşlərində və Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - həyatı dövründə çox sayda ərəb müşrikini öldürməsi idi, hətta onu "ərəblərin qatili" adlandırırdılar; ərəb evlərindən elə bir ev qalmamışdı ki, onun fərdlərindən biri Əlinin əlindən ölməmiş olsun. Bu səbəbdən qəlblərdə qalan kin və ədavət Peyğəmbərin - salləllahu aleyhi va əlihi va səlləm - bu həyatdan köçməsindən sonra öz işini gördü və bir çox səhabənin Allahın və Rəsulullahın Əli haqqındakı açıq sözlərinə məhəl qoymamasına, əmirlik və xilafətdə onun haqqını qəsd etməsinə səbəb oldu. Bu arqument ilkin baxışda inandırıcı görünsə də, daha dərin tədqiqat və araşdırma ilə, bunun doğru elmi əsasının olmadığı və tarixi şahidliklərlə uyğun olmadığı məlum olur. Çünki Əli - aleyhissələm - İslamın erkən döyüşlərində çox sayda ərəb müşrikini öldürmüş olsa da, öldürdüyü kəslərin heç biri Əbu Bəkrə beyəti təsis etmiş mühacirlərin və ənsarın qohumlarından deyildi. Hətta mühacirlərdən bəzilərinin yaxın qohumlarının Əli - aleyhissələm - tərəfindən öldürüldüyü fərz edilsə belə — halbuki biz belə bir hadisəni bilmirik — Allahın razılığını

[937] "Məğazi əl-Vaqidi", 1/149; "ər-Ravd əl-Unf", 5/208, əl-Bələzuri, 1/298;
[938] əl-Bələzuri, 1/153-154

qazanmaq və İslamın yaşaması uğrunda öz atalarını, qardaşlarını öz əlləri ilə öldürmüş mömin mühacirlərin, Əliyə qarşı onların müşrik qohumlarından kimlərisə öldürdüyü üçün nifrət etmələri imkansızdır. Bəli, Əli Qureyşin kafirlərindən bəzi kimsələri öldürmüşdü və onların qohum-əqrəbası sonradan müsəlman olmuşdular. Bu kimi şəxslərin qəlblərində o mübarək zata qarşı nifrətin qalması mümkündür. Bunların böyüklərindən biri Əbu Sufyan idi ki, Əli onun arvadının atasını və qardaşını öldürmüşdü. Amma belə kimsələrin xəlifə seçimində heç bir haqqı və rolu olmayıb, çünki bu haqq mühacirlərə, ənsara, Bədr və Uhud döyüşündə döyüşmüş mücahidlərin haqqı idi. O "tuləqa" dediklərimizin onların sırasına daxil olmaq haqları yox idi. Üstəlik Əbu Süfyan müxalifət tərəfdə idi; Əbu Bəkrin beyətinə etiraz edənlərdən və - zahirə görə - Əlinin xeyrinə qruplaşanlardan idi."[939]

Bu iddianı yalanlayan bir başqa tərəf budur ki, səhabələr özləri İslam uğrunda öz atalarına, qardaşlarına, əmilərinə və digər qohumlarına qarşı vuruşublar, bəzən də özləri onları öldürüblər. Abdullah bin Abdilləh bin Ubeyy öz atasını qəsd edərək peyğəmbərə - salləllahu aleyhi va səlləm - demişdi: "Diləsən onun başını sənə gətirim."[940] Muhəmməd bin Sad deyir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - vəfat etdikdə Said bin əl-As'ın doqquz yaşı var idi. Onun atası əl-As bin Said bin əl-As bin Umeyyə Bədr günü kafir olaraq öldürülmüşdü. Ömər bin əl-Xattab (bir dəfə) Said bin əl-As'a dedi: "Səni (mənə qarşı) niyə soyuq davranarkən görürəm? Sanki mənim sənin atanı öldürdüyümü düşünürsən. Onu mən yox, Əli bin Əbi Talib öldürüb, əgər mən öldürmüş olsaydım bir müşriki öldürdüyüm üçün üzrxahlıq etməzdim, lakin mən öz dayımı, əl-As bin Hişəm bin əl-Muğira bin Abdilləh bin Ömər bin Məxzum'u öz əlimlə öldürmüşəm." Bunun üzərinə Said bin əl-As dedi: "Ey möminlərin əmiri, əgər öldürmüsənsə sən haqq, o isə batil üzərində olub." Ömər onun bu cavabına sevindi."[941] Sözü gedən Said bin əl-As daha sonra Mədinədə vali olmuşdu. Əli bin Əbi Talib'in Fatimədən olan qızı Ummu Kulsum və Ummu Kulsum'un oğlu Zeyd vəfat etdikdə onların cənazəsini Said bin əl-As qılıb. İmam Əhməd deyir: "Huşeym bizə rəvayət etdi; dedi: Yunus bin Ubeyd bizə Bənu Haşimin mövlası Ammar'dan belə dediyini rəvayət etdi: "Əlinin qızı Ummu Kulsum'un və (oğlu) Zeyd bin Ömər'in

---

[939] Qələmdəran, "Tariqul-İttihəd", səh: 96-97;

[940] "Musnəd əl-Bəzzər", 14/322 (7978); əl-Heysəmi deyir: "Bunu əl-Bəzzər rəvayət edib və raviləri siqadır." (Məcmə əz-Zəvaid, 9/318 (15761))

[941] "ət-Tabəqat əl-Kubra", 5/31; Dar Sadir

vəfatına şahid oldum; onların ikisinin cənazəsini Said bin əl-As qıldı, Ummu Kulsumu Zeyd bin Ömərdən önə qoydu."[942] Həmçinin əl-Həsən bin Əli - radiyallahu anhu - öldükdə onun da cənazəsini Said bin əl-As qılmışdır.[943] əl-As bin Said'i kimin öldürməsi haqqında fərqli rəvayətlər vardır; Əbu Ubeyd, Əhməd, ət-Tabəri'nin və digərlərinin rəvayət etdiyinə əsasən onu Sad bin Əbi Vaqqas öldürüb, "zul-kətifə" adlı böyük bir qılıncı varmış, onu götürərək Allahın elçisinə - salləllahu aleyhi va səlləm - gətirir, o isə qılıncı qənimətlərin toplandığı yerə atmasını istəyir.[944] əl-Bələzuri isə onu öldürənin Həmzə olduğunu yazır.[945] Belə görünür ki, rəvayət baxımından ən doğru olan onun Sad bin Əbi Vaqqas tərəfindən öldürülmüş olmasıdır. İstənilən halda burada Ömər öz dayısını öldürdüyünü etiraf edir. Abdullah bin Şəvzəb qopuq isnadla rəvayət edir ki, Əbu Ubeydə bin əl-Cərrah Uhud döyüşündə öz atasını öldürmüşdü.[946] Malik bin Umeyr əl-Hənəfi rəvayət edir ki, səhabələrdən biri döyüşlərdən birində peyğəmbərin - salləllahu aleyhi va səlləm - yanına gəlir və deyir: "Düşmənlə qarşılaşdım, atam onların arasında idi və sənin haqqında çirkin bir söz söylədiyini eşitdim. Buna səbr etməyib onu nizə ilə öldürdüm." Bunun üzərinə peyğəmbər susdu."[947] Əbuz-Zinəd rəvayət edir ki, Əbu Huzeyfə bin Utbə Bədr döyüşündə iştirak etdi və atası Utbə bin Rabia'nı təkbətək döyüşə çağırdı. Buna görə bacısı Hind bint Utbə'nin onu söydüyü, lənətlədiyi rəvayət olunur.[948] Bir başqa rəvayətdə isə müsəlmanları təkbətək döyüşə çağıran Utbə bin Rabia idi və buna cavab olaraq ilk qalxan oğlu Əbu Huzeyfə oldu, lakin Allahın elçisi - salləllahu aleyhi va səlləm - ona oturmasını əmr etdi.[949] İbn Sad isnadı ilə Urva bin əz-Zubeyr'in belə dediyini rəvayət edir: "Rahib Əbu Amir'in oğlu Hanzala Allahın elçisinə dedi: "Ey Allahın elçisi, atamı öldürümmü?" Dedi: "Atanı öldürmə!" [950] Bu, ilk zifaf gecəsindən sonra Uhud döyüşünə gedərək orada öldürülmüş və cəsədini mələklərin yuduqları Hanzala bin Əbi Amir idi.

---

942 "əl-İləl va Mərifətur-Ricəl", 1/140 (25)

943 əl-Bələzuri, "Əşraful-Ənsəb", 3/64;

944 Əbu Ubeyd, "əl-Əmval", səh: 382 (756); Əhməd, "əl-Musnəd", 3/129 (1556); İbn Zəncəveyh, "əl-Əmvəl", 2/674 (1126); "Təfsir ət-Tabəri", 13/373; Darut-Tərbiyə

945 əl-Bələzuri, "Əşraful-Ənsəb", 1/146;

946 ət-Tabərani, "əl-Mucəm əl-Kəbir", 1/154 (360); Əbu Nueym, "əl-Hilyə", 1/101; əl-Hakim, "əl-Mustədrak", 3/265; "Sünən əl-Beyhəqi", 9/27

947 əl-Fəsəvi, "əl-Mərifə vat-Tarix", 1/343;

948 İbn Sad, "ət-Tabəqat əl-Kubra", 3/85; Dar Sadir

949 "Məğazi əl-Vaqidi", 1/70;

950 İbn Sad, "ət-Tabəqat əl-Kubra", 4/291 Xanəci

Möminlərin əmiri Əli bin Əbi Talib də səhabələr ilə birlikdə öz qohumlarına qarşı vuruşduqlarını belə vəsf edirdi: “Biz, Rəsulullah – salləllahu aleyhi və alih – ilə birgə olduğumuz zaman, atalarımızı, oğullarımızı, qardaşlarımızı və əmilərimizi öldürürdük. Amma bütün bunlar bizim yalnız imanımızı artırır, təslimiyyətimizi möhkəmləndirir, haqq yolunda irəliləməyimizə səbəb olur, acı ağrılara qarşı səbrimizi gücləndirir və düşmənlə cihad etmək üçün əzmimizi daha da artırırdı.”[951] Üstəlik Mədinə şəhərində həqiqi güc ənsarın əlində idi və ənsar razılaşmasaydı nə Əbu Bəkr, nə də qeyrisi xəlifə ola bilməzdi. Qureyşlilərə, xüsusilə də mühacirlərə qarşı formalaşmış bu təsəvvür heç bir şəkildə ənsara qarşı işə yaramır. Bəs o zaman ənsar nə üçün iddia olunan əhdə xəyanət etdi?!

Üstəlik Əbu Bəkr və Ömər iddia olunduğu kimi hakimiyyətə rəğbətli deyildilər. Səqifə hadisəsindən tutmuş xəlifəliklərinin sonuna qədər atdıqları addımlar bunu təsdiqləyir. Səqifə görüşündə Əbu Bəkr ənsara öz namizədliyini yox, Öməri və ya Əbu Ubeydə’ni təklif etmişdi. Ömər isə Əbu Bəkrin çıxışındakı bu namizəd təklifini xatırlayır və deyir: “Allaha and olsun ki, onun bu təklifi istisna olmaqla dediklərinin hamısını bəyənmişdim. Aralarında Əbu Bəkrin olduğu bir qövmə əmirlik etməkdənsə boynumun vurulması mənə daha xoş idi…”[952] Əgər Əbu Bəkr xəlifəliyə bu qədər can atırdısa nə üçün başqalarını namizəd göstərirdi. Nə üçün Ömər bu namizədlik ilə razılaşmır, əksinə Əbu Bəkrin xəlifə olmasını istəyirdi. Ortadakı iddia budur ki, Əbu Bəkr və Ömər hakimiyyətə həris olduqları üçün peyğəmbərin - aleyhissələm - əhdinə xəyanət etdilər. Əgər bu doğrudursa nə üçün Ömərin hakimiyyət hərisliyi Əbu Bəkrin qarşısında zəif düşdü?! Üstəlik Əbu Bəkr özü bu ittihamı yalanlayır və deyir: “Allaha and olsun ki, nə tək bir gün, nə də tək bir gecə belə əmirliyə həris olmamışam, ona rəğbət göstərməmişəm və nə gizlində, nə də aşkarda Allahdan onu istəmişəm.”[953] Həmçinin rəvayət olunur ki, Əbul-Cəhhəf Davud bin Əbi Avf deyib: “Əbu Bəkrə beyət edildikdə üç gün qapısını bağlı saxladı və dedi: “Ey insanlar, məni öz beyətinizdən azad edin!” Hər dəfəsində də Əli ona dedi: “Səni azad etməyəcəyik, məqamını tərk etməyini də tələb etməyəcəyik. Allahın elçisi - salləllahu aleyhi va səlləm - səni

---

[951] “Nəhcul-Bəlağa”, 1/105;

[952] “Sahih əl-Buxari”, 6830

[953] “Əhədis Muntəxabə min Məğazi Musa bin Uqbə”, səh: 94 (19)

(namazda) qabağı keçirdi, səni kim arxaya alacaq ki?!"[954] Bu xəbər sünnət əhlinin kitablarında səhih olmasa da şiələr bunu öz kitablarında "məni beyətimdən azad edin, çünki Əli aranızda olduğu müddətdə mən sizin ən xeyirliniz deyiləm" sözləri ilə nəql edirlər; bununla da Əlinin - Əbu Bəkrin öz etirafı ilə - daha əfzəl, daha xeyirli olduğunu isbat etməyə çalışırlar. əl-Məclisi bu xəbərin səhih olduğunu yazır, "çünki bu xəbər müstəfiddir və hər əsrdə, hər zamanda məşhur olub." Əlavə edir ki, sünnilərdəki "ana qaynaqların müəlliflərinin bu xəbəri rəvayət etməməklərinə gəldikdə isə bunda heç bir hüccət yoxdur, çünki onlar öz məsləhətlərinə uyğun olmayanları rəvayət etmirlər."[955] Bu xəbərin doğruluğunu isbat etmək üçün əl-Məclisi üstəlik "Nəhcul-Bələğa" kitabında keçən və Əliyə nisbət olunan bir xütbəni dəlil gətirir. Beləki o xütbədə - iddiaya görə - Əli Əbu Bəkri nəzərdə tutaraq deyir: "Nə qədər də əcaibdir! Özü sağ ikən (xəlifəlikdən) özünü azad etmək istəsə də vəfat etdikdən sonra onu başqasına verdi."[956] Əgər şiələr həqiqətən də Əbu Bəkrin sağ ikən xəlifəlik məqamını buraxmaq istədiyini, onu başqasına tərk etmək istədiyini deyirlərsə, necə olur ki, eyni zamanda onun xəlifəliyə həris olduğunu iddia edirlər?! Məgər bu, bir insanı ittiham etmək üçün ələ keçən hər pisliyi ona atmaq deyilmi?! Əgər xəlifəlik beyətindən qurtulmaq istəyirdisə bu yalnız bir şeyə dəlalət edə bilərdi; Əbu Bəkr hakimiyyətə həris bir şəxs deyildi.

Bütün bu iddiaları yalanlayan daha bir tərəf isə budur ki, xəlifələr hər zaman əhlul-beytə qarşı sevgi və hörmət nümayiş etdiriblər. Əbu Bəkr deyib: "Allaha and olsun ki, Allahın elçisinin - salləllahu aleyhi va səlləm - qohumlarına, öz qohumlarıma qayğı göstərməyimdən daha sevimlidir."[957] Ömər bin əl-Xattab isə deyib: "İraqın xumsu gələrsə evləndirmədiyim bir haşimi buraxmayacam, kənizi olmayanlarına da xidmətçi tutacam." Dedi: "əl-Həsən və əl-Hüseynə (ordan pay) verərdi."[958] Həmçinin əş-Şabi deyir: "Zeyd bin Sabit anasının

---

[954] Bu xəbəri İmam Əhmədin oğlu Abdullah "Fədailus-Sahabə" kitabında (101, 102, 132) iki fərqli isnad ilə rəvayət edir. Birində bunu Əli bin Haşim bin əl-Bureyd atasından, o da Əbul-Cəhhəf'dən rəvayət edir, digərində isə Təlid bin Süleyman bunu ondan rəvayət edir. Təlid münkər ravidir, Əli bin Haşim və atası isə şiə olmaqlarına baxmayaraq mühəddislər tərəfindən saduq olaraq qəbul olunublar. Əbul-Cəhhəf özü də aşırı şiə olmaqda ittiham olunub, lakin siqa sayılıb. Amma Əbul-Cəhhəf ilə Əbu Bəkr arasında bir qopuqluq var. Bu baxımdan bu isnad səhih deyildir.

[955] əl-Məclisi, "Bihər əl-Ənvar", 30/503-504;

[956] İbn Əbil-Hədid, "Şərh Nəhc əl-Bələğa", 1/162;

[957] "Sahih əl-Buxari", 3810

[958] Əbu Ubeyd, "əl-Əmval", səh: 419; (855)

cənazəsini qıldı, sonra onun qatırını gətirdim ki, minsin. Bu zaman İbn Abbas gəldi və onun üzəngindən tutdu. Zeyd dedi: "Ey Allahın elçisinin əmisi oğlu, burax onu!" İbn Abbas dedi: "Alimlərimiz ilə bu cür davranmalıyıq." Bunun üzərinə Zeyd onun əlini öpdü və dedi: "Peyğəmbərimizin əhli beyti ilə bu cür davranmağımız əmr olunub."[959] İbn Əbi Şeybə rəvayət edir ki, Əbu Harun dedi: "İbn Ömər ilə birlikdə oturmuşdum və onun yanına Nəfi bin əl-Əzraq gəldi və başının üstündə durdu və dedi: "Allaha and olsun ki, mən Əliyə nifrət edirəm." İbn Ömər başını qaldırıb ona baxdı və dedi: "Allah sənə nifrət etsin, sən elə bir adama nifrət edirsən ki, onun İslam dininə göstərdiyi xidmətlərdən bir dənəsi belə dünya və onun içindəkilərdən daha xeyirlidir."[960] İmam əl-Buxari'nin rəvayətində isə deyilir ki, "bir nəfər İbn Ömərin yanına gəldi və ondan Osman haqqında soruşdu. İbn Ömər onun gözəl əməllərindən danışdı və sonra soruşdu: "Bəlkə bu dediklərim səni narahat edir?" Adam dedi: "Bəli." İbn Ömər dedi: "Allah burnunu yerə sürtsün, alçaltsın səni!" Sonra həmin adam ondan Əli haqqında soruşdu. İbn Ömər onun da gözəl əməllərindən bəhs etdi və dedi: "Bəli, bu elə onun fəzilətləridir. Və bax, bu ev, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – evlərinin ortasındakı ev onun evidir. Bəlkə bu da səni incidir?" Dedi: "Bəli!" İbn Ömər dedi: "Allah burnunu yerə sürtsün! Get, əlindən gələni mənə qarşı et!"[961] Muhəmməd bin Sirin deyir: "(Əbu Hureyra bir gün) Əlinin oğlu əl-Həsən ilə qarşılaşdı və dedi: "Allahın elçisini – salləllahu aleyhi va səlləm – sənin qarnını öpərkən gördüm. Allahın elçisinin – salləllahu aleyhi va səlləm öpdüyü o yero aç öpmək istəyirəm." əl-Həsən həmin yeri açdı və (Əbu Hureyra) öpdü."[962] Bu və buna bənzər çox sayda rəvayət vardır ki, səhabələrin əhlul-beyt üzvlərinə qarşı ehtiramını və sevgisini göstərir və əgər biz bu barədə dəlillər gətirmək istəsək bunun üçün müstəqil bir əsər yazmaq olar.

Hədis qaynaqlarında müxtəlif yollarla sabit olub ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - son xəstəliyində Əbu Bəkrə insanlara namaz qıldırmağı əmr etdi. İmam Malik deyir: "Hişəm bin Urvə bizə atası (Urva bin əz-Zubeyr)dən, o da peyğəmbərin - salləllahu aleyhi va səlləm - zövcəsi Aişədən belə dediyini rəvayət etdi: "Peyğəmbər (xəstə

---

[959] əl-Qadi İyad, "əş-Şifə bi Tərif Huquq əl-Mustafə", 2/50; əl-Bələzuri, "Ənsəbul-Əşraf", 4/46;
[960] İbn Əbi Şeybə, "əl-Musannəf", 6/373 (32127);
[961] "Sahih əl-Buxari", 3501;
[962] əl-Hakim, "əl-Mustədrak", 5/731; ər-Risələ çapı

ikən) dedi: "Əbu Bəkrə buyurun ki, insanlara namaz qılsın!" Aişə dedi: "Ey Allahın elçisi, Əbu Bəkr sənin yerinə keçsə ağladığından insanlara səsini eşitdirə bilməyəcək. Ona görə də Ömərə əmr et ki, insanlara namazı qıldırsın." Dedi: "Əbu Bəkrə buyurun ki, insanlara namaz qıldırsın!" Aişə dedi: "Hafsa'ya dedim: "Ona de ki, Əbu Bəkr sənin yerinə keçsə ağladığından insanları eşitdirə bilməyəcək. İnsanlara namaz qıldırmağı Ömərə tapşır!" Hafsa bunu etdi. Bunun üzərinə Allahın elçisi - salləllahu aleyhi va səlləm - dedi: "Siz Yusufun ətrafındakı qadınlarsız! Əbu Bəkrə deyin ki, insanlara namazı qıldırsın!" Hafsa Aişəyə dedi: "Səndən onsuz da mənə xeyir gəlməyəcəkdi!"[963] Bu hədisi Aişə'dən bacısı oğlu Urva'dan başqa həm də əl-Qasim bin Muhəmməd, Alqamə, əl-Əsvad, Məsruq, Ubeydullah bin Abdilləh bin Utbə, Həmzə bin Abdilləh bin Ömər və başqaları rəvayət edir. Həmçinin İbn Şihəb əz-Zuhri deyir: "Ənəs bin Malik mənə rəvayət etdi ki, müsəlmanlar bazar ertəsi günü fəcr namazını qılarkən və Əbu Bəkr onlara namazı qıldırarkən onları anidən təəccübləndirən Allahın elçisi - salləllahu aleyhi va səlləm - oldu: Aişənin otağının pərdəsini açdı, onlara baxdı və onlar namazda sırada durmuşdular, sonra təbəssüm edərək güldü. Buna görə Əbu Bəkr geri çəkildi ki, sıraya qoşulsun və elə güman etdi ki, Allahın elçisi - salləllahu aleyhi va səlləm - namaza çıxmaq istəyir. Allahın elçisi - salləllahu aleyhi va səlləm - onlara əli ilə işarə etdi ki, namazlarını tamamlasınlar."[964] Bunu əz-Zuhri'dən Yunus bin Yezid bin Əbin-Nəcəd, Uqeyl bin Xalid bin Uqeyl, Şueyb bin Əbi Həmzə, Məmər bin Raşid, Saleh bin Keysən, Sufyan bin Uyeynə, İbn Cureyc və başqaları rəvayət edir. əz-Zuhri'dən başqa bunu Ənəs bin Malik'dən Abdulaziz bin Suheyb əl-Bunəni əl-Basri rəvayət edir: "Allahın elçisi - salləllahu aleyhi va səlləm - üç gün (məscidə) çıxmadı. Sonra namaza iqamə verildi, Əbu Bəkr getdi ki, qabağı çıxsın və bu zaman Allahın elçisi - salləllahu aleyhi va səlləm - qalxaraq pərdəni qaldırdı. Onun üzü göründükdə biz peyğəmbərin - salləllahu aleyhi va səlləm - üzündən daha xoş bir mənzərə görmədik. Bunun üzərinə peyğəmbər Əbu Bəkrə əli ilə işarə etdi ki, qabağı keçsin və peyğəmbər pərdəni aşağı saldı. Ondan sonra ölənə qədər yürüyə bilmədi.[965] Bunu Ənəsdən həmçinin Humeyd ət-Tavil də rəvayət edib. Bu xəbəri həmçinin Əbu Musa əl-Əşari, Abdullah bin Abbas, Abdullah bin Zəm'a, Əbu Said əl-Xudri, İbn Ömər, Abdullah bin Məsud, Əbu

---

[963] "Muvatta Məlik", 2/238 (591/181) Yəhya'nın rəvayəti

[964] "Sahih əl-Buxari", 754, 1205 və 4448; əs-Sultaniyyə çapı

[965] "Sahih Muslim", 100; "Sahih əl-Buxari", 681

Sələmə bin Abdirrahmən, Səlim bin Ubeyd və başqa səhabələr rəvayət edirlər. Bu hadisə mütəvatir yolla sabit olmuşdur. İlk dönəm şiə alimləri də bu həqiqəti inkar etmirdilər, əksinə təsdiqləyirdilər. Şiələrin alimlərindən Əbu İshaq ən-Növbəxti'nin sözlərindən bu, açıq şəkildə anlaşılır. Çünki yazır: "Səqifədə aşkar nassın zikr olunmaması və onların bir-biriləri ilə razılaşmaqları onların üzləşdikləri bir şübhəyə görə idi; səhabələr elə güman etdilər ki, Əbu Bəkrin namazda önə keçirilməsi əvvəlki hökmləri nəsx edir."[966] Burada şiə qardaşlarımızı düşündürən sual bu olmalıdır; əgər Əli bin Əbi Talib – radiyallahu anhu - peyğəmbərin vasisi, xəlifəsi, onun qiyabında möminlərin əmiridirsə nə üçün peyğəmbərin – aleyhissalətu vassələm – son xəstəliyində namazda müsəlmanlara imamlıq etmədi?! Əbu Bəkrin imam olması faktını inkar etmək bu problemi yenə də həll etmir, çünki Əli – kərraməllahu vachəhu – Peyğəmbərin – salləllahu aleyhi va sələm – sağlığında vəziri, ölümündən sonra onun xəlifəsi idisə xəstə olduğu günlərdə müsəlmanlara namazda onun imamlıq etməsi lazım idi. Lakin onun müsəlmanlara namaz qıldırdığına dair əlimizdə heç bir xəbər yoxdur. Belə bir hadisə müsəlmanların qarşısında baş vermiş olduğu üçün bu barədə mütəvatir xəbərlərin varid olması gözlənilən bir haldır. Nəzərə almağımız lazımdır ki, Allahın elçisinin – aleyhissələm – xəstəliyi tək bir namaz müddətində çəkməyib, əksinə günlərlə xəstə olaraq yataqda yatıb. İbnul-Cəvzi yazır ki, "onun xəstəliyi müddəti haqqında ixtilaf edilib. Biz bunun on üç gün olduğunu zikr etdik, on iki gün olduğu da deyilib."[967] əl-Məqrizi deyir ki, xəstə olduğu müddətdə "namaz qılmağa çıxardı, lakin üç gün çıxmadı."[968] İbnul-Cəvzi də yazır ki, "xəstə olduğu müddətdə insanlara namaz qılırdı, sadəcə olaraq üç gün qıldırmadı. (Qıldırmadığı namazların sayının) on yeddi namaz olduğu da deyilib."[969] Üç gün ərzində ən azından on beş namazı insanlara kimsə qılmışdır. Şiə alimlərindən Muhəmməd Rza əl-Muzaffər yazır: "Belə hesab edirəm ki, hadisənin əsli belə olub ki, peyğəmbər (s) evindən çıxması mümkün olmadıqda insanlara namaz qılmaqlarını əmr etdi, kimisə imam olaraq xüsusiləşdirmədi…"[970] Qeyd etdiyimiz kimi hətta bu iddianın doğruluğunu qəbul etsək belə ciddi bir problem olaraq qalır, çünki bizə gələn xəbərlər mütəvatir şəkildə isbat edir ki, müsəlmanlara imamlıq edən Əbu Bəkr olub. Əlinin –

[966] Növbəxti, "əl-Yaquf fi İlm əl-Kələm", 82;
[967] İbnul-Cəvzi, "əl-Muntəzam", 4/26;
[968] əl-Məqrizi, "İmtəul-Əsmə", 14/456;
[969] İbnul-Cəvzi, "əl-Muntəzam", 4/31;
[970] Muzaffər, "əs-Səqifə", səh: 58; Muəssəsətu Ənsariyən, Qum, 1415;

radiyallahu anhu – insanlara imamlıq etməməsi bir daha onu göstərir ki, o, özündən belə bir vəzifəyə sahib olduğunu düşünmürdü.

## İmamların elmi mirasının keyfiyyəti

Önəmli bir məsələyə burada yaxından nəzər salmağımız lazımdır. İmamlara etiqad etməyən sünnət əhlinin dini bilmək və öyrənmək üçün mənbələri Quran, sünnət, icma və qiyasdır, səhabələrin sözlərinin və fellərinin hüccət olması isə sünnət əhli arasında ixtilaflı məsələdir. Sünnət əhlindən fərqli olaraq şiələrdə iddia etdikləri imamların təlimləri də mövcuddur və bu, onların etiqadına əsasən şiələri sünnət əhlindəki fəsaddan, ixtilafdan qurtarmalı və onları fərqli etməlidir. Çünki imami şiələri imamların mövcud olmasını zəruri hesab edirlər, bu cür imamların mövcud olması Allahın göndərdiyi dinin qorunulması, onun insanlara doğru şəkildə öyrədilməsi üçün lazımdır. Ona görə də imamların təyin olunmasını Allah üçün vacib hesab ediblər və deyiblər ki, Allahın imamları təyin etməsi Onun ədalətinə və lütfünə zidd olardı. Şeyxut-Taifə ət-Tusi deyir: "İmamətin vacibliyinin bir başqa dəlili budur ki, biz bilirik ki, bilməyimizə ehtiyac olan hadisələrin hökmlərinin hamısının dəlilləri qəti deyildir, nə mütəvatirdir, nə də icmadır. Əgər şəriətlə əməl etməyə mükəlləf edilmişiksə onu bilməyimiz üçün, ümmətin ixtilaflı rəylərindən hansının doğru olduğunu bilməyimiz üçün bir yolun olması vacibdir və bu yol, səhv və xəta etməyəcəyindən əmin olduğumuz məsum imamdan başqası ola bilməz, ona görə də ona qayıdır və ona etimad edirik."[971] Beləliklə də Əli bin Əbi Talib'dən - kərraməllahu vachəhu - başlayaraq Həsən əl-Askəri'yə qədər gəlib keçmiş imamların insanlara dini doğru şəkildə öyrətməkləri, dini qorumaqları, dinin çətin tərəflərini asan bir şəkildə izah etməkləri gərək idi. Görəsən həqiqətən də belə olubmu?

Şiələrdə rəvayət kitablarını açdığımızda dinin əhkamları ilə bağlı rəvayətlərin yoğun bir şəkildə ilk imamlarından yox, beşinci imamdan sonra başladığını görmək mümkündür. Yəni Əli bin Əbi Talib, onun iki oğlu əl-Həsən və əl-Hüseyn və nəvəsi Əli bin əl-Hüseyn şiələrə dini

---

[971] ət-Tusi, "Təmhidul-Usul", səh: 510;

əhkamı aktiv bir şəkildə öyrətməyiblər, ən azından biz bunun kitablarda əks olunduğunu görə bilmirik. Bunu hətta şiələrin nəql etdikləri xəbərlər də təsdiqləyir. Bir rəvayətdə Cəfər əs-Sadiq deyir: "Ondan sonra Əli bin əl-Hüseyn gəldi. Sonra isə Muhəmməd bin Əli Əbu Cəfər gəldi və Əbu Cəfər gəlmədən əvvəl şiələr həccin ayinlərini, nəyin halal və nəyin haram olduğunu bilmirdilər. Əbu Cəfər gəldi və onlara elmin qapılarını açdı, onlara həccin ayinlərini, halalları və haramları öyrətdi."[972] Beləliklə də əgər Cəfər əs-Sadiqə nisbət edilən bu sözləri təsdiqləməli olsaq ilk dörd imam şiələrə öz dinləri ilə bağlı əhkamı öyrətmək vəzifəsini layiqincə yerinə yetirə bilməyiblər. Buradan belə anlaşılır ki, şiələrə dini hökmləri ilk dəfə layiqincə öyrədənlər Muhəmməd əl-Baqir və oğlu Cəfər əs-Sadiq olub. Üstəlik şiə rəvayətlərinə inanmalı olsaq imamların sözləri anlaşılması qəliz olan növdəndir, hər kəs onların dediklərini anlaya bilməz. Bir rəvayətdə İmam Əbu Cəfər'in - aleyhissələm - belə dediyini qeyd edirlər: "Məhəmməd ailəsinin təlimləri çətin və dərindir. Yalnız yaxın bir mələk, göndərilmiş bir peyğəmbər və ya Allahın qəlbini imanla sınadığı bir qul onlara iman gətirər. Məhəmməd ailəsinin təlimlərindən sizə nə gəlsə və qəlbiniz ona yumşalır və qəbul edirsə, onu qəbul edin. Amma əgər qəlbiniz ondan çəkinsə və onu rədd etsə, onu Allaha, Rəsula və Məhəmməd ailəsindən olan alime geri qaytarın. Həqiqətən, məhv olan, ona bir təlimin çatdırıldığı və bunu qəbul edə bilməyən, sonra isə 'Allaha and olsun ki, bu belə deyil!' deyən şəxsdir."[973] Bir başqa rəvayətdə Şueyb əl-Həddəd deyir: "Mən Cəfər əl-Sadiqdən - aleyhissələm - eşitdim ki, belə dedi: "Bizim təlimlərimiz çətindir və çətin hesab olunur; yalnız yaxın bir mələk, göndərilmiş bir peyğəmbər, Allahın qəlbini imanla sınadığı bir qul və ya möhkəm bir şəhər onları daşıya bilər." Amr dedi: Beləliklə, Şueybə soruşdum: "Ey Əbu əl-Həsən, möhkəm şəhər nədir?" O cavab verdi: "Mən bu barədə əs-Sadiqə - aleyhissələm - soruşdum və o mənə dedi: "Bu, sabit bir qəlbdir."[974]

Lakin bununla belə onların təlimlərini rəvayət etmiş ravilərə, bu xəbərləri özündə cəm etmiş kitablara etibar etmək olarmı? Şiə kitablarındakı rəvayətlərə etibar etmək şiə mənzərindən bir çox problemlə qarşılaşır. Bu problemlərdən biri yalan problemidir. Şiələr

---

[972] əl-Kuleyni, "əl-Kafi", 2/19-21; əl-Kuleyni bu xəbər üçün iki rəvayət zikr edir və əl-Məclisi "Miratul-Uqul" kitabında (7/108) hər iki sənədi ilə səhih olduğunu yazır.

[973] əl-Kuleyni, "əl-Kafi", 1/401;

[974] əl-Məclisi, "Bihər əl-Ənvar", 2/183

özləri də etiraf edir ki, onların sıralarında əhlul-beytin adından yalan danışanlar çox olub. Bunun ən bariz göstəricisi budur ki, Cəfər əs-Sadiq ömrü boyunca Mədinə şəhərində yaşamış olsa da onun məzhəbini rəvayət edənlər bir qayda olaraq Kufə şəhərində yaşayıblar. Hətta Cəfər əs-Sadiq'in ömrünün sonlarında Kufəyə gəlməsi haqqındakı xəbərlər belə səhih deyildir. Bu böyük imam, Mədinə əhlindən olub, Mədinədə fəaliyyət göstərib və orada dəfn olunub; özünün, atasının və babasının qəbri Baqi məqbərəsindədir.[975] Bütün bunlara baxmayaraq Cəfər əs-Sadiq'dən şiələrə müvafiq olan etiqadı rəvayət edən ən ümdə ravilər İraqda yaşayıblar və onların nə zamansa elm almaq üçün Mədinə şəhərinə yerləşməkləri sabit olmayıb. ən-Nəcəşi kitabında kufəli ravi əl-Həsən bin Əli əl-Vaşşə'nin belə dediyini rəvayət edir: "Əgər bilsəydim ki, hədislərə bu qədər tələb olacaq onları daha çox toplayardım; çünki mən bu məsciddə doqquz yüz şeyx gördüm ki, hamısı "mənə Cəfər bin Muhəmməd rəvayət etdi" deyirdi."[976] Əgər təkcə əl-Həsən əl-Vaşşə bir məsciddə doqquz yüz ravi ilə qarşılaşıbsa və bu ravilərin hamısı İmam Cəfərdən hədis eşitdiyini iddia edibsə o zaman yalanın nə qədər yayğın olduğunu təsəvvür etmək mümkündür, çünki şiələrin özlərinin iddiasına əsasən İmam Cəfər əs-Sadiq dövlətin nəzarətində yaşayırdısa və buna görə təqiyyə etməyə məcbur idisə təkcə bir quşaqdan doqquz yüz nəfər kufəli nə zaman, hansı şəraitdə Cəfərdən bu hədisləri eşidiblər və rəvayət ediblər?! Örfən belə bir şey mümkün deyildir. Bu həqiqəti görmək və onu dərk etmək çətin olmamalıdır. Dönəmin məşhur sünni hədis alimlərindən bir çoxu Cəfər əs-Sadiq'in Mədinə şəhərində hədis rəvayət etdiyi məclislərdə iştirak ediblər, ondan hədis yazıblar. Ondan hədis rəvayət etməklə tanınmış və Mədinə şəhərində yaşamış ravilərdən heç biri ondan bu qədər hədis rəvayət etməyib. Əslində hansısa bir ravinin Cəfər kimi birindən bu qədər hədis eşitdiyini iddia etməsi özü həmin ravinin yalançı olduğunu göstərmək üçün kifayət etməlidir. İbn Əbi Asim "əs-Sunnə" kitabında səhih bir isnadla rəvayət edir: "əl-Əşac bizə rəvayət etdi; Əbu Usəmə bizə əl-Aməş'dən, o da Məsud bin əl-Həkəm'dən belə dediyini rəvayət etdi: "Əli bin əl-Hüseyn mənə dedi: "Said bin Cubeyr ilə oturub durursan?" Dedim: "Bəli." Dedi: "Mən onunla oturub durmağı sevirəm, onun söhbətini sevirəm." Sonra əli ilə Kufə tərəfə işarə etdi və dedi: "Onlar bizim haqqımızda bizdə olmayan şeylər deyirlər."[977] Şiə alimi Muhəmməd əl-Baqir əl-

[975] bax: əl-Ğazəli, "İhyə Ulum əd-Din", 1/260;

[976] ən-Nəcəşi, "Ricəl ən-Nəcəşi", səh: 39-40; Muəssəsətun-Nəşr əl-İsləmi, Qum, 1418;

[977] İbn Əbi Asim, "əs-Sunnə", 2/482 (rəq: 998);

Behbudi yazır: “Əgər bir ravi fiqh və maarif mövzularında geniş ölçüdə böyük həcmli bir əlyazma çıxararsa və bunun misal üçün İmam Əbu Cəfər əl-Baqir’in isnadları və ya İmam Əbu Abdilləh əs-Sadiq’in isnadları olduğunu iddia edərsə, bu zaman bunun imamın adından yalan olduğunu qəti olaraq bilirik, çünki imamlar sünnilərdən təqiyyə edirdilər, zərurət olmadığı halda onlara rəvayət etmirdilər və onlara fətva vermirdilər. Səhih tarixdə imamlardan hansısa birinin şeyxlərin isnad məclisində oturub “bizə filankəs rəvayət etdi” dediyini görməmişik.”[978] Ona görə də zeydi şiələrin məşhur imamı Əbu Talib əl-Haruni[979] deyir: “On iki imam şiələrinin isnadlarının xeyli bir hissəsi realda mövcud olmamış, yalnız adları olan ravilər üzərində qurulub… Onların arasında çoxca rəvayət etmiş elə ravilər vardır ki, əlinə keçmiş isnadsız xəbərlərə isnadlar uydurmağı halal hesab edirdi. Onlardan bəzilərinin (sasani vəzir) Bozorgmihr’in rəvayətlərini toplayıb onları uydurduğu isnadlar ilə imamlara nisbət etdiyi nəql olunub. Ona niyə belə etdiyi soruşulduqda isə - “Hikməti öz əhlinə nisbət edirəm” - deyə cavab verib.”[980] əl-Haruni zaman baxımından Şeyx əl-Mufid’in müasirlərindəndir və erkən imami rəvayət prosesləri ilə yaxından tanışdır. Misal üçün Muhəmməd bin Muslim bin Riyəh əs-Səqafi adı ilə tanınan məşhur şiə ravisi iddia olunana görə Muhəmməd əl-Baqir’dən otuz min, oğlu Cəfərdən isə on altı min hədis soruşub.[981] Kufədə sünnət əhlinin böyüklərindən olan Qadi İbn Əbi Leyla, İmam Əbu Hənifə kimi alimlər - şiə kitablarındakı iddiaya görə - onun üstünlüyünü etiraf ediblər.[982] Lakin necə olur ki, bütün bunlara baxmayaraq sünnət əhlinin kitablarında bu şəxsiyyət haqqında zərrə qədər də olsun bir məlumat tapılmır; nə əleyhinə, nə də leyhinə heç kim danışmayıb. Necə ola bilər ki, Kufənin böyükləri yanında tanınmış olsun, Mədinədə Muhəmməd əl-Baqir və Cəfər əs-Sadiqdən birlikdə qırx altı min hədis eşitsin, amma bununla belə sünnət əhlindən heç kimsə onu tanımasın?! Halbuki sünnət kitablarında İmran bin Muslim bin Riyəh əs-Səqafi adında etibarlı bir ravi vardır ki, Kufədə yaşayıb və Əli bin Əbi Talibin

---

[978] əl-Behbudi, “Mərifətul-Hədis”, səh: 131;

[979] Tam adı Yəhya bin əl-Hüseyn bin Harun bin əl-Hüseyn bin Muhəmməd bin Harun bin Muhəmməd bin əl-Qasim bin əl-Həsən bin Zeyd bin əl-Həsən bin Əli bin Əbi Talibdir, əhlul-beyt nəslindəndir və zeydilərin böyük alimlərindəndir. Təbəristandakı Amul şəhərində doğulub, əd-Deyləm ərazisində imam olaraq beyət olunub və 80 yaşlarında vəfat edib.

[980] Nəşvan əl-Himyəri, “əl-Hurul-Ayn”, səh: 307; Dar Azal/əl-Məktəbə əl-Yəməniyyə, 1985

[981] əl-Xoyi, “Mucəm Ricəl əl-Hədis”, 18/263;

[982] ət-Tabəsi, “Muhəmməd bin Muslim ət-Taifi”, səh: 41-56; Qum, 1434

tələbələrindən hədislər rəvayət edib. Şiələrin iddiasına görə bu Muhəmməd, İmranın qardaşıdır.

Həmçinin böyük ravilərindən daha biri Bureyd bin Muaviyə sünnət əhlinin kitablarında məchul ravi hesab olunur. Şiə alimi Əbu Amr əl-Kəşşi deyir: "Yəhya bin Abdulhəmid əl-Həmməni "əl-Muəlləf fi İsbət İməməti Əmir əl-Muminin" adlı kitabında deyir: "Şərik (bin Abdilləh)ə dedim: "Bəzi kimsələr Cəfər bin Muhəmməd'in hədisdə zəif olduğunu iddia edirlər." Dedi: "Qoy sənə bir şey deyim. Cəfər bin Muhəmməd saleh, müsəlman, vəra sahibi biri idi. Bir qrup cahil onun ətrafına toplandı, yanına girib çıxırdılar və "Cəfər bin Muhəmməd bizə rəvayət etdi" deyirdilər və hamısı münkər olan, yalan və uydurma olan hədisləri Cəfərin adından rəvayət edirdilər. Bununla insanların əlindəkiləri yeyirdilər, onlardan bunun qarşılığında pul alırdılar. Beləliklə də bu yolla bütün münkərləri ortaya çıxardılar, nəticədə avam kütlə bütün bunları onlardan eşitdi, kimisi həlak oldu və kimisi də inkar etdi."[983] Belə anlaşılır ki, bu məsələ şiələrin özləri arasında da məlum bir məsələ olub. Müasir şiə alimlərindən Hüseyn ər-Radi əl-Abdullah deyir: "Ravilərin xeyli bir hissəsi İmam əs-Sadiqin yanına daxil olurdular və ondan hədis dinləyirdilər, sonra (ordan) çıxıb buna müxalif şəkildə möcüzələr, xariquladələr və ya xurafatlar danışıb bunu imama nisbət edirdilər. Digərləri bunu eşitdikdə onların bir hissəsi bunu yalanlayır, bir hissəsi təsdiqləyir və üçüncü bir qrup isə məzhəbdən sapırdılar…"[984] Biz bu sözlərə kiçik bir düzəliş etməliyik; bu ravilər heç imamların evinə də daxil olmurdular, lakin onları ziyarət etdiklərini, onlardan hədis eşitdiklərini iddia edirdilər. Bütün bunlara baxmayaraq şiə alimləri yalana qarşı yumşaq davranırlar. Misal üçün Abdullah bin Bukeyr şiələrdə "icma əshabından" olan bir digər ravidir. Şiə kitablarında "talaq" fəslində keçən məlumatlara əsasən, Abdullah bin Bukeyrə görə bir kişi qadını boşayarsa, iddət müddətində qaytarmazsa, iddət müddəti bitdikdən sonra yenidən təklif edib onunla evlənərsə üç boşama haqqı olduğu kimi qalır. Şeyxut-Taifə ət-Tusi bir rəvayətdə onun bu rəyi Zurara bin Ayun vasitəsi ilə birbaşa İmam əl-Baqirdən rəvayət etdiyini isnadı ilə qeyd edir. Daha sonra buyurur: "Lakin bu rəvayətin isnadı Abdullah bin Bukeyr'dəndir, daha əvvəl gətirdiyimiz xəbərlərdə keçdiyinə əsasən ondan bu barədə soruşulduqda demişdi: "Bu, Allahın mənə açdığı bir rəydir." Əgər bu xəbəri Zurara'dan eşitmiş olsaydı əl-Hüseyn bin Hişəm və başqaları ondan bu barədə bir rəvayətin olub

---

[983] ət-Tusi, "İxtiyər Mərifətir-Ricəl", 2/616; Mehdi ər-Racəi təhqiqi. Muəssəsətu Al əl-Beyt,

[984] əl-Abdullah, "əl-Muaməra əl-Kubra alə Mədrasəti Əhl əl-Beyt", səh: 9-10;

olmadığını soruşduqlarında “bəli, Zurara’nin rəvayəti vardır” deməsi lazım idi…Halı belə olan şəxsin öz fətvasına dəstək olsun deyə belə bir xəbəri Zurara’ya isnad etmiş olması və yoldaşlarının ondan öz rəyi ilə verdiyi fətvanı qəbul etmədiklərini gördükdə bunu Əbu Cəfərdən rəvayət edən birinə istinad etməsi mümkündür. Abdullah bin Bukeyr belə bir şey etməsi mümkün olmayan məsum bir şəxs deyildir…”[985] Beləliklə də Şeyxut-Taifə ət-Tusi burada məharətlə Abdullah bin Bukeyrin yalanını ifşa edir; onun fiqhi bir məsələdə İmam əl-Baqir’in adından necə yalan danışdığını göstərir. Bununla belə Abdullah bin Bukeyr şiələrdə etibar ediləcək bir ravidir. Görəsən bunu necə qəbul edə bilirlər? Əbul-Qasim əl-Xoyi çəkinmədən, tərəddüd etmədən buyurur: “Şeyxin “əl-İstibsar” kitabında zikr etdiyinə gəldikdə isə bu, onun etibarlılığı ilə ziddiyyət təşkil etmir. Ən pis halda Şeyx (ət-Tusi) Abdullah bin Bukeyrin xüsusilə bu rəvayətdə öz rəyini dəstəkləmək üçün yalan danışdığını ehtimal etmişdir. Məlumdur ki, xüsusi bir məqamda hansısa bir xüsusiyyət üçün yalan danışmaq ehtimalı ravinin özlüyündə etibarlı olması ilə ziddiyyət təşkil etməz.”[986] Burada normal insanın heyrəti araya girir; axı necə ola bilər ki, adamın özündən rəvayət uydurduğu öz təsdiqini tapsın, lakin bununla belə siqa və mötəbər olaraq qalsın?! Bu, açıq-aşkar ziddiyyətdir. Yoxsa əl-Xoyi’yə görə bir kimsənin haqq bildiyi bir məsələyə dəstək məqsədi ilə rəvayət uydurması onun ədalətini düşürmək üçün kifayət etmir?! Qəribə deyildir ki, əl-Xoyi’dən bidət sahibi və zəlalət təbliğ edən biri ilə mübahisə, münaqişə məqamında onun arqumentlərini çürütmək üçün yalan danışmağın icazəli olduğu soruşulduqda bu cavabı verib: “Əgər onun batilini rədd etmək bundan asılıdırsa o zaman icazəlidir.”[987] Əgər arqument xatirinə müxalifin batil olduğuna etiqad etdiyimiz etiqadını rədd etmək üçün, batil çıxarmaq üçün yalan danışmaq icazəlidirsə, müxaliflərin əleyhinə yalandan hədislər uydurmaq da eyni məntiqlə icazəli olmalıdır. Möhtəmələn o dövrün şiə raviləri arasında belə bir təsəvvür hakim olub. Ona görə də şiə kitablarında imamların adından yalan xəbərlər yayğın olub.

İbrahim bin Haşim əl-Qummi də bu baxımdan maraqlı bir ravidir. Onun oğlu Əli bin İbrahim əl-Qummi və özü şiə hədis kitablarında ən məhsuldar iki ravidir, yəni onlardan çox hədis rəvayət edən və ya ümumiyyətlə onlara yaxın düşən başqa ravi yoxdur. əl-Kuleyni “əl-

---

[985] ət-Tusi, “əl-İstibsar fimə İxtələfə min əl-Əxbər”, 3/338; Darul-Hədis,

[986] əl-Xoyi, “Mucəm Ricəl əl-Hədis”, 11/132;

[987] “Siratun-Nəcət fi Əcvibətil-İstiftəət”, 1/447;

Kafi" kitabında 7068 rəvayəti məhz Əli bin İbrahim'dən rəvayət edir, Əli isə onlardan 6214-ünü atası İbrahim'dən rəvayət edir.[988] əl-Kuleyni "əl-Kafi" kitabında Əli bin İbrahim'dən, o da atası İbrahim bin Haşim əl-Qummi'dən belə dediyini rəvayət edir: "Əbu Cəfər'in - aleyhissələm - yanına kənar bölgələrdən olan şiələrdən bir qrup daxil olmaq üçün izn istədi. O da onlara izn verdi, beləliklə də daxil oldular və ondan bir məclisdə otuz min sual soruşdular. (İmam) - aleyhissələm - suallara cavab verdi və onun bu zaman on yaşı var idi."[989] Bu xəbər isnad baxımından şiə alimlər tərəfindən səhih qəbul edilir, çünki dediyimiz kimi əl-Kuleyni bunu öz şeyxindən, o da öz atasından rəvayət edir. Burada Əbu Cəfər ilə qəsd olunan doqquzuncu imam Əbu Cəfər Muhəmməd əl-Cavad'dır. Bu rəvayətin absurd olduğu onsuz da mətnindən anlaşılır, çünki otuz min sualın hər birinin yarım dəqiqə çəkdiyini fərz etsək buna ən azından 10 gün vaxt lazımdır və buna yalnız gecələr yatmadan nail ola bilər. Ona görə də şiə alimlərindən Muhəmməd Hüseyn Tərhini əl-Amili deyir: "Rəvayətin mətni onun yalan olmasının ən yaxşı dəlilidir, çünki bir insanın bir məclisdə otuz min suala cavab verməsi necə mümkün ola bilər? Hətta bu suallara cavab verməyin İmam əl-Cavad'a asan olduğunu fərz etsək belə yenə də sual verənlərin bir məclisdə otuz min sual verməsi necə mümkün ola bilər? Bunun üçün bu məclisin bir neçə gecə-gündüz davam etməsi lazımdır. Hətta hər bir sual-cavabın yalnız bir dəqiqə çəkdiyini fərz etsək, otuz min dəqiqə beş yüz saata bərabərdir; bu isə o mənaya gəlir ki, otuz min suala cavab vermək iyirmi sutkadan çox bir vaxt çəkməlidir, o zaman bu müzakirə necə bir məclisdə baş verə bilmişdi?"[990] Əgər bu rəvayətin mətni Şeyx Tərhini'nin dediyi kimi yalandırsa o zaman bu yalanı uyduran ravilərdən biri isnaddadır. İbrahim bin Hişəm əl-Qummi'nin xüsusilə çoxca hədis rəvayət etdiyi ravilərdən biri Muhəmməd bin Əbi Umeyr Ziyad bin İsa əl-Əzdi olub, ondan təklikdə üç minə yaxın hədis rəvayət edib.[991] Bu İbn Əbi Umeyr haqqında şiələrin ricəl alimi ən-Nəcəşi yazır: "Həm bizə görə, həm də müxaliflərimizə görə qədri böyük, mərtəbəsi əzəmətlidir…"[992] Şeyxut-Taifə ət-Tusi də deyir: "Həm şiələrdə, həm də sünnilərdə ən etibarlı

---

[988] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 19/59, 1/292 və 12/213;

[989] əl-Kuleyni, "əl-Kafi", 1/496;

[990] Tərhini, "Aqidətul-İməmiyyə beynəl-Əsil vad-Daxil", səh: 466;

[991] Eyni mənbə, 1/292;

[992] "Ricəl ən-Nəcəşi", səh: 326;

şəxslərdən idi."[993] Həm ən-Nəcəşi, həm də ət-Tusi burada İbn Əbi Umeyr'in sünnilərə görə etibarlı bir ravi olduğunu dediklərində yalan danışırlar, çünki sünnət əhlinin kitablarında bu ravi haqqında heç bir məlumat verilmir, başqa cür desək məchuldur. Lakin İbrahim bin Haşim ondan üç minə yaxın hədis rəvayət edir. Şiə ricəl alimləri qeyd edirlər ki, İbn Əbi Umeyr dörd il həbsdə ikən kitablarını bacısı gizlədib, lakin onlar məhv olub. Bundan sonra öz əzbərindən rəvayət etməyə başlayıb. Kitabları məhv olduğu üçün hədisləri mürsəl rəvayət etməyə məcbur olduğu və hətta bəzi ravilərin adlarını unutduğu deyilir.[994] ən-Nəcəşi bununla bağlı deyir: "Beləliklə, (kitabları) məhv oldu, və o, yaddaşından və insanların əlində əvvəlcədən mövcud olanlardan rəvayət etdi. Buna görə də, bizim əshabımız onun *mürsəl* (sənədsiz) rəvayətlərinə etibar edirlər."[995] əl-Ğureyfi bunu təəccüblə qarşılayaraq məntiqli sual verir: "Kitablarının itməsi və tələf olmasının onun mürsəllərinə necə etibar qazandırdığını bilmirəm."[996] Çox maraqlıdır ki, kitabları məhv olmuş, hakimiyyət dairələrindən gizlənməyə çalışmış bir ravidən İbrahim bin Haşim üç minə yaxın xəbər rəvayət edə bilib. İmamlar haqqında aşırı etiqadı təmsil edən rəvayətlərin sənədlərində tez-tez bu İbrahim bin Haşim əl-Qummi ilə qarşılaşırıq. Muhəmməd bin əl-Həsən əs-Saffər "Bəsair əd-Dəracət" kitabında deyir: "İbrahim bin Haşim mənə Abdulaziz bin əl-Muhtədi'dən, o da Abdullah bin Cundub'dan onun belə dediyini rəvayət etdi ki, (İmam) Əbul-Həsən (Əli ər-Rida) ona bir məktub yazdı: "Biz bir nəfəri gördüyümüzdə onun həqiqi iman, yoxsa həqiqi nifaq əhli olduğunu bilirik."[997] Halbuki Allahu təalə buyurur: "Ətrafınızdakı bədəvi ərəblərdən və Mədinə əhalisindən ikiüzlülükdə məharətli olan münafiqlər var. Sən onları tanımırsan, Biz isə onları tanıyırıq…"[9:101] İbrahim bin Haşim və ondan başqa ravilər bu şəkildə Qurana tam bir mənada zidd olan etiqadları imamlar haqqında rəvayət ediblər. İbrahim bin Haşim'dən gələn isnadla bir başqa rəvayətdə iddiaya görə İmam ər-Rida deyib: "Biz (insanların başına gələcək) müsibətləri və ölümləri bilirik, ərəblərin nəsəblərini və müsəlman olaraq doğulanları bilirik."[998] Allah isə deyir: "Həqiqətən, qiyamət haqqındakı məlumat Allah yanındadır. Yağışı O yağdırır.

[993] əl-Hilli, "Xulasatul-Aqval", 1/240;
[994] əl-Ğureyfi, "Qavaidul-Hədis", 1/81-82;
[995] "Ricəl ən-Nəcəşi", səh: 326;
[996] əl-Ğureyfi, "Qavaidul-Hədis", 1/82;
[997] əs-Saffər, "Bəsair əd-Dəracət", səh: 308;
[998] Eyni mənbə, səh: 287;

Bətnlərdə olanı da O bilir. Heç kim sabah nə qazanacağını bilə bilməz. Heç kim harada öləcəyini də bilə bilməz. Şübhəsiz ki, Allah hər şeyi biləndir, hər şeydən xəbərdardır.” [31:34]

Hətta şiələrin müxalifləri erkən bir zamanda onlara qarşı yalan xəbərlərin və ixtilafların çoxluğunu əks-arqument olaraq gətiriblər. Zeydi şiələrinin imamlarından olan Əbu Zeyd əl-Ələvi (vəfatı h. 326) imami şiələrindəki bu ixtilafları, heyrəti onlara qarşı istifadə edir, onların fərz etdikləri on ikinci imamın bütün bunlar qarşısında susmağını qınayır və deyir: “Üstəlik onların ixtilafları ya şiələrin özlərindən qaynaqlanır, ya onlara nəql edənlərdən ya da imamlarından qaynaqlanır. Əgər ixtilaflar imamların özündən qaynaqlanırsa, (həqiqi) imam insanları birləşdirən bir imam olmalıdır, yoxsa ümmət arasında - *xüsusilə də düşmənləri deyil, təqiyyəyə ehtiyac buraxmayacaq dərəcədə tərəfdaşı olan öz şiələri arasında* - ixtilafa səbəb olan kəs imam ola bilməz. O zaman şiələr ilə ümmət arasındakı fərq nə oldu? Beləki şiələr - *öz imamları, Allah tərəfindən göndərilmiş hüccətləri olduğu halda* - dində ixtilaf etməkdə, bir-birilərini təkfir etməkdə, heç bir imamları olmayan, qınadıqları ümmətdən daha çox ixtilaf ediblər. Yox əgər onların ixtilafı (imamlardan yox) onlara dini nəql edənlərdən qaynaqlanırsa, o zaman onlara öyrətdikləri bu imam məsələsinin də - *xüsusilə də əgər iddia olunan bu imam fiziki olaraq mövcud deyilsə və heç kim onu görməyibsə* - bu cür (yalan) olmamasına nə qarantiya var?! Əgər bu imamın özü ilə şiələri arasındakı nümayəndələri və tərcümanları yalançıdırlarsa, onun adından yalan danışırlarsa və onun bundan xəbəri yoxdursa, o zaman bu, onların “imam qeybi bilir” iddialarına qarşı arqumentdir. Əgər dində ixtilafı çıxaranlar imamlar deyil, şiələrin özləridirsə o zaman şiələrin Allahla aralarında tərcüman olduğunu, onların üzərində Allahın hüccəti olduğunu iddia etdikləri və şiələrin arasında gəzən, lakin onlara bu ixtilafları qadağan etməyən bir imama nə ehtiyacları var?! Bu da o imamın mövcud olmadığının və qeybi bilmədiyinin ən böyük dəlillərindəndir, çünki əgər mövcud olsaydı öz şiələrinə (bu ixtilafı aradan qaldırmaq üçün) bəyan etməməsi icazəli olmazdı, çünki Allah deyir: “Biz Kitabı (Quranı) sənə yalnız ixtilafda olduqları məsələləri onlara izah etməyin üçün və möminlərə hidayət və rəhmət olsun deyə nazil etdik.” [16:64] Allahın elçisi ümmətinə bəyan etdiyi kimi imama da eynisini şiələrinə bəyan etmək vacibdir.” Əbu Zeyd əl-Ələvi’nin bu sözlərini şiə alimi İbn Bəbəveyh əl-Qummi (vəfatı h. 381) “əl-İşhəd” kitabından nəql edir və daha sonra cavab verməyə çalışır. Lakin əl-Qummi’nin verdiyi cavab şiələrin bu

məsələdə necə heyrət və sıxıntılar içində olduğunu təsdiqləmiş olur. Beləliklə də o, cavabında buyurur: "Şübhəsiz ki, imami şiələrin ixtilafının qaynağı yalnız və yalnız müəyyən zamanlarda özlərini şiələrin arasına soxmuş yalançılardır. Şiələrin sələfləri vəra, ictihad və salamat baxış üzərinə dayanan kimsələr olublar və kritik düşüncə, dəqiq təfəkkür sahibi olmayıblar. Ona görə də xəbərləri rəvayət edən halı qapalı bir kimsəni gördüklərində onun haqqında gözəl zənn edər və xəbərini qəbul edərdilər. Bu çoxaldıqda və zahir olduqda imamlarına şikayət etdilər, beləliklə də imamlar onlara üzərində icma olanı qəbul etməyi əmr etdilər, lakin onlar buna əməl etmədilər və əvvəlki adətlərinə davam etdilər. Beləliklə də xəyanət imamlar tərəfdən yox, onların tərəfindən qaynaqlanır. İmam da rəvayət edilmiş bütün bu qarışıq hədislərin hamısından xəbərdar deyildi, çünki qeybi bilmirdi. O sadəcə Kitab və sünnəti bilən saleh bir bəndədir və öz şiələrinin halından yalnız ona çatanları bilir."[999] Əgər Qum şəhərinin böyük mühəddislərindən sayılan bu alim şiələrin arasında böyük ixtilaflara səbəb olacaq dərəcədə uydurma rəvayətlərin yayıldığını etiraf edir. Bu məsələ ümumiyyətlə şiə alimləri arasında qəbul edilmiş bir məsələdir, onlar sadəcə olaraq bu uydurma xəbərlərin nə zaman başlaması, hansı mərhələlərdə yayılması haqqında fərqli fikir irəli sürürlər. Misal üçün Muhəmməd əl-Baqir əl-Bəhbudi əhlul-beytin hədislərinin iki əsas mərhələdən keçdiyinə inanır; bunlardan birincisi təqiyyə və gizlilik dövrü, ikincisi isə ğulat və zındıqlar tərəfindən hədis uydurma dörvrü. əl-Behbudi birinci dövrdə "əhlul-beytin hədislərinin ğulatların kələkləri və saxtakarlıqlarından qorunulduğuna" inanır. Çünki bu dövrdə imamların tələbələri hədisləri gizlində öyrənirlər, müzakirə edirlər və rəvayət edirlər. "Amma ikinci dövrdə, hədis əhli və məzhəbin aparıcı şəxsiyyətləri çoxaldıqdan, qaynaq kitablar geniş yayıldıqdan və varraqlar, kitab üzü köçürənlər onları öz tədavüllərinə saldıqdan sonra xain aşırıların və zındıq xəfiyyələrin əlləri onların miraslarına dəyişiklər etdilər, beləliklə ora əlavələr etdilər, ordan bəzi şeyləri çıxardılar, bəzilərini dəyişdilər, Allahın haramını halal, halalını haram etdilər. Bu zaman ziddiyyətlər və fərqlər o qədər çoxaldı ki, fiqh və maarif babında elə bir hədis yoxdur ki, onun yanında ona müxalif olan bir başqa hədis olmasın, salamat elə bir hədis yoxdur ki, onun müqabilində ona zidd olan və onu inkar edən bir başqa hədis olmasın. Bu şəkildə ziddiyyət və ixtilaf əqidələrə, fətvalara və fiqhi hökmlərə yol tapdı."[1000] Lakin

---

[999] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", səh: 109;

[1000] əl-Behbudi, "Mərifətul-Hədis", səh: 72;

Haşim Məruf əl-Həsəni bu məsələdə əl-Bəhbudi ilə razılaşmır, əksinə ona görə birinci dövrdə də hədislərdə saxtakarlıq və yalan olub. Onun nəzərində şiələrdə hədis uydurma əməliyyatı erkən bir zamanda başlayıb. Deyir: "Şiəliyə daxil olmuş ən təhlükəli qrup zahirdə əhlul-beyti sevdiklərini deyən bir qrup olub ki, onlar uzun bir müddət ərzində ravilərin və imamların tələbələrinin arasına özlərini sala biliblər. Bu müddət ərzində iki imama, əl-Baqir və əs-Sadiqə yaxınlaşmağı bacarıblar və ravilərdən bir qrup onlara arxayın olublar, beləliklə də böyük bir sayda hədislər uydurublar və onları imamların hədisləri arasına, hədisdə qaynaq olan kitabların arasına salıblar. Necəki buna bəzi rəvayətlər işarə edir…" Daha sonra bu rəvayətlərin bəzilərini qeyd edir: "Əbul-Həsən ər-Rida'dan belə dediyi (xəbərdə) gəlir: "Bəyən (bin Səman) Əli bin əl-Hüseyn'in adından yalan danışırdı, buna görə Allah ona qızmar dəmiri daddırdı. əl-Muğira isə Əbu Cəfər əl-Baqir'in adından yalan danışırdı, Muhəmməd bin Furat isə Əbul-Həsən Musa bin Cəfərin adından, Əbul-Xattab isə Əbu Abdilləh əs-Sadiqin adından yalan danışırdı."… əl-Muğiradan belə dediyi xəbərdə gəlib: "Cəfər bin Muhəmmədin xəbərləri arasına on iki min hədis uydurdum." O və onun davamçıları uzun müddət şiələrin sıralarında qaldılar, onlarla birlikdə imamların məclisinə getdilər və hədis kitabları içində ilk üsul kitabları onların rəvayətləri ilə dolana qədər halları üzə çıxmadı…" Hişəm əl-Həsəni daha sonra önəmli bir nöqtəyə toxunur və deyir: "Heç bir şəkk yoxdur ki, əl-Muğira və onun davamçıları saxta rəvayətləri imamların əshabından olan etibarlı şəxslərə nisbət edirdilər ki, onların həqiqətləri üzə çıxmasın."[1001] əl-Həsəni bu dediklərini öz kitablarında keçən rəvayətlərə əsasən qeyd edir. Hətta əl-Kəşşi'dən gətirdiyi rəvayətdə Cəfər əs-Sadiqin dili ilə izah edir ki, əl-Muğira bin Said və onun davamçıları sadəcə olaraq hədis uydurmaqla kifayətlənmirdilər, onlar İmam əl-Baqir'in etibarlı tələbələrinin kitablarını köçürmək üçün onları müvəqqəti götürərdilər, sonra içinə küfr, nifaq və digər batil məsələri salardılar, beləliklə də o kitablar şiələr arasında mötəbər qaynaqlar olaraq yayılardı. əl-Behbudi bu həqiqəti etiraf edir və detallı şəkildə izah edir: "Bəzən tanınmış bir qaynağı və ya məşhur bir kitabı götürərdilər, ondan bir neçə nüsxə köçürərdilər və onların içinə uydurduqları hədisləri daxil edərdilər və ya öz istəklərinə uyğun şəkildə sözlərini təhrif edərdilər. Nüsxəni tamamlayıb bitirdikdən sonra üzündə (yalandan) qeyd edərək yazardılar: "Fılan ayda fılankəsə tələbələrinin hüzurunda oxundu." Sonra içinə hiyləylə daxil edilmiş bu nüsxələri

---

[1001] əl-Həsəni, "əl-Məvduat fil-Əsər val-Əxbər", səh: 148-150; Dar ət-Təarif, Beyrut, 1407

əlyazma köçürənlərin dükanlarına paylayardılar və ya mühəddislərdən zəif olanlara verərdilər. Bəzən də içində aşırılıq və yalanlar olan tam bir əlyazmanı sıfırdan uydurardılar və üz qabığında "fılankəsin əsli", "fılankəsin kitabı" yazardılar, sonra bu saxta nüsxələri üzköçürənlərin kitabları arasına hiylə ilə daxil edərdilər və ya onları oxuma-yazma bilməyən uşaqların və ya yaşlı qadınların əlləri ilə satardılar ki, guya bu kitablar böyük mühəddislərdən (onların ailələrinə) miras qalıb." Sonra buyurur: "Öz hiylələrinin həyata keçməsi üçün və yalanlarının yayğınlaşması üçün əlyazmalardan heç bir təhqiq və dəqiqləşdirmə olmadan hədis götürməyin icazəli olmasına dair hədislər uydurdular. Aşırı və yalançı ravilərdən heç bir sıxıntı olmadan hədis rəvayət etməyə icazə verən rəvayətlər uydurdular. Beləliklə də sadəlövh şeyxlərdən və qafil ravilərdən bir qrup bu hiyləyə - və bu, hiylələrin ən çirkinidir - aldandılar və bu uydurulmuş yalanları öz kitablarına aldılar, onların batillərini, əfsanələrini yaymaqda çox səy göstərdilər və gözəl bir iş gördüklərini zənn etdilər.[1002]

## Uydurulmuş kitablar

Zamanımıza qədər gəlib çatmış kitablarda da şiə mirasındakı bu fenomen özünü ciddi bir şəkildə göstərir. Bu çox önəmli bir göstəricidir, çünki məsələ sadəcə rəvayətlərin uydurulmasından getmir; bütöv kitabların uydurulmasından danışırıq. Bu kitablar yəni xəyali şəxslərə, ya da real tarixi şəxslərə nisbət olunaraq onların adlarından uydurulmuş kitablardır. Bu gün şiələr üçün xütbələrdə oxunan materialların əhəmiyyətli bir hissəsi həmin bu kitablara əsaslanır. Burada bəzi misallar ilə tanış olmağımız məqsədəuyğundur.

**Süleym bin Qeysin kitabı** bu misallardan biridir, bəlkə də ən məşhurudur. əl-Kuleyni "əl-Kafi" kitabında, əs-Saduq "əl-Fəqih"də, ət-Tusi isə "ət-Təhzib" kitabında Süleym'in sözü gedən kitabından rəvayətlər gətirirlər. əl-Məclisi "Biharul-Ənvar" kitabında tez-tez bu kitabdan rəvayətlər gətirir. əl-Əmini on iki cildlik "əl-Ğadir" kitabında Süleym'in kitabına etibarlı bir qaynaq kimi istinadlar edir, ordan nəqllər

---

[1002] əl-Behbudi, "Mərifətul-Hədis", səh: 77-79;

gətirir. Xüsusilə də Təqi əl-Məclisi, əl-Hurr əl-Amili, Muhəmməd Baqir əl-Məclisi, Yusuf əl-Bəhrani, Mirzə əl-Məzəndərani kimi əxbari alimləri Süleymin kitabına etibar edirlər. Hətta İbnud-Nədim deyir ki, "şiələrin kitabları içində ilk üzə çıxan kitab Süleym bin Qeys əl-Hiləli'nin kitabıdır; onu Əbən bin Əbi Ayyəş rəvayət edir və ondan başqası rəvayət etmir."[1003] Hətta İmam Cəfər əs-Sadiq'ə nisbət etdikləri bir xəbərdə iddiaya görə belə deyib: "Kim ki, bizim şiələrimizdən və sevənlərimizdən olub da Süləyim ibn Qeys əl-Hiləlinin kitabı onun yanında yoxdursa, deməк ki, bizim işimizdən heç nə yanında yoxdur və bizim işlərimizin səbəblərindən heç nə bilmir. O kitab, şiənin əlifbasıdır və Muhəmmədin ailəsinin sirlərindən bir sirdir."[1004]

Bəs Süleym kimdir? Süleym ibn Qeys — ona nisbət edilən kitabda yer alan bəzi rəvayətlərə əsasən — hicri 37-ci ilin əvvəlində, yəni Siffin döyüşünün hərir gecəsində qırx yaşında idi. Bu isə deməyə əsas verir ki, o, hicrətdən üç il əvvəl anadan olmuşdu. Görünür, Kufə şəhərində dünyaya gəlmişdir. Eləcə də Süleymə nisbət verilən rəvayətlərin mövcud nüsxələrindəki digər məlumatlara əsasən, o, 24 yaşında olarkən Həccə getmiş, daha sonra Mədinəyə qayıtmışdı. Onun Rəbəzə şəhərinə də səfəri olmuşdur. Lakin bu səfərin müstəqil bir səfər olub-olmadığı və ya başqa bir səfərin tərkibində gerçəkləşdiyi bəlli deyil. Hicri 35-ci ildə, yəni İmam Əlinin (ə) xilafətə gəlməsi ilə eyni vaxtda, Mədinədən Kufəyə, oradan da Mədainə köç etmişdir. Bu səfərin də müstəqil olub-olmadığı qeyri-müəyyəndir. Daha sonra Siffinə getmiş və həmin hadisədən sonra Kufədə yaşamışdır. Hicri 50-ci ilə yaxın bir tarixdə o, Mədinəyə səfər etmiş, oradan isə Müaviyə ilə birlikdə Məkkəyə getmişdir. Daha sonra Məkkədən Kufəyə qayıtmışdır. Onun Kufədən Bəsrəyə səfəri də olmuşdur, lakin bu səfərin müstəqil olub-olmadığı bəlli deyil. Sonda isə hicri 75-ci ildə Kufədən qaçaraq Fars bölgəsində yerləşən Nübəndcana getmiş və orada vəfat etmişdir. Beləliklə, Süleym ibn Qeys — ona nisbət verilən kitaba əsasən — ondan çox mühüm və tarixi şəhərə səfər etmişdir. Ən azı üç dəfə Mədinə şəhərinə getmiş, iki dəfə isə Məkkədə Həcc ziyarətində olmuşdur. O, eyni zamanda Mədain, Bəsrə, Nübəndcan, Rəbəzə və Siffin kimi şəhərlərə də səfər etmişdir. Əgər Süleym ibn Qeys doğulub boya-başa çatdığı ilk illərdə — ləqəbindən də göründüyü kimi — Kufədə və ya onun ətrafında yaşamışdırsa, o zaman onun İslama gəlişi

[1003] İbnun-Nədim, "əl-Fihrist", səh: 271, İbrahim Ramazan çapı; 2/69, Əymən əs-Seyyid çapı.
[1004] ən-Nuri, "Mustədrak əl-Vasəil", 17/298;

və Mədinə şəhərinə hicrəti necə baş vermişdi? Bu məsələni aydınlaşdırmaq vacibdir. Çünki məlum olduğu kimi, müsəlmanlar İraq istiqamətində ilk dəfə hicri 14-cü ildə yürüş etmiş, Kufə isə yalnız hicri 17-ci ildə — İranda fəthləri davam etdirmək məqsədilə hərbi düşərgə kimi salınmışdır. Bu faktlar göstərir ki, İraq və Kufə əhalisinin istər könüllü, istərsə də məcburi şəkildə İslamı qəbul etməsi məhz həmin dövrlərdə — yəni hicri 14 ilə 17-ci illər arasında — baş vermişdir. Bu zaman Süleym təxminən 17-20 yaşlarında idi. Bu məlumatlar fonunda Süleym ibn Qeysin həmin dövrdəki həyatının necə keçdiyi, onun nə şəkildə Mədinəyə getdiyi və orada hədis rəvayət etməyə başladığı bizə tam aydın deyil. Bu dövr onun həyatındakı ən vacib dönüş nöqtələrindən biri olsa da, təəssüf ki, bu barədə əlimizdəki mənbələrdə dəqiq məlumat yoxdur.

Süleym ibn Qeysin adına nisbət verilən kitablarda irəli sürülən ən mühüm iddialardan biri onun imam Əlinin xüsusi səhabələrindən biri olmasıdır. Bu kitablarda imam Əli ilə bağlı bir çox rəvayət və hadisənin məhz Süleymin dilindən nəql edildiyini görürük. Hətta Süleymin kitabında belə onun imam Əli ilə dərin və sıx əlaqəsini vurğulayan çoxsaylı nümunələr mövcuddur; belə ki, Süleymin imam Əlinin vəfat anında da, onun vəsiyyətini oxuduğu zaman da orada iştirak etdiyi bildirilir. Hətta Süleymə nisbət verilən kitablarda mövcud olan rəvayətlərin hamısının imam Əli ilə bağlı olduğunu deməsək belə, ən azından demək olar ki, bu əlyazmalarda yer alan rəvayətlərin 70%-i birbaşa imam Əli və onun ətrafında baş verən hadisələrlə əlaqəlidir. Süleym ibn Qeysin Haşim oğulları ilə, xüsusilə də İbn Abbasla əlaqəsi diqqətəlayiqdir. Hətta görünür ki, Süleymin kitabına inanmalı olsaq Haşim oğulları Süleymi özlərindən biri hesab edirmişlər. Hətta Süleymə nisbət verilən mövcud kitablardakı bəzi rəvayətlərə əsasən, Süleym imam Əlinin bütün övladları ilə görüşüb söhbət etmişdir. Məsələn, imam Əlinin şəhid edilməsindən sonra, Süleym Mədinədə onun iki oğlu – Həsən və Hüseynə ataları Əlidən eşitdiyi bir hədisi nəql edir və hədisin sonunda onların bu nəqli təsdiqlədiklərini qeyd edir. Eləcə də, bundan bir neçə onillik sonra imam Zeynülabidinlə, yanında oğlu imam Baqir olduğu halda görüşür və ona "babasından, atasından və əmisindən" eşitdiyi şeyləri təkrar edir və guya İmam Baqir atasının və Süleym ibn Qeysin sözlərini təsdiqləyir.

Bu və digər məlumatlara əsasən bir çox tədqiqatçı alim Süleymin real tarixi şəxsiyyət olmadığını deyiblər. Çünki erkən tarixi qaynaqlar

İmam Əli'nin silahdaşları və yoldaşları arasında Süleym bin Qeys əl-Hiləli adı ilə tanınan hansısa bir şəxs haqqında məlumat vermirlər. Süleym haqqında ilk məlumatlar ona nisbət edilən kitabdan qaynaqlanır, digər kitablarda mövcud olan məlumatların hamısı öz əslini həmin kitabdan götürür. əl-Məzəndərani'nin "Şərh Usul əl-Kəfi" kitabına qeydlər yazmış Mirzə Əbul-Həsən əş-Şərani bu həqiqəti belə ifadə edir: "Süleym'dən nəql olunduğunu gördüyümüz hər bir şey bu məşhur kitabdandır."[1005] ən-Nəcaşi və ət-Tusi'nin müasirlərindən sayılan bağdadlı şiə alimi İbnul-Ğadairi "Ricəl" kitabında yazır: "Bizim şeyxlərimiz belə deyərdilər ki, Süleym tanınmır, heç bir xəbərdə onun adı hallanmır."[1006] Bəli, həqiqətən də Süleym bin Qeys haqqında xəbərlərin bütün qaynaqları sözü gedən kitaba gedib çıxır. Başqa müstəqil kitabların heç birində İmam Əli'nin və oğullarının yanında Süleym bin Qeys adlı bir şəxsin olduğuna dair heç bir dəlil yoxdur. Halbuki Süleymə nisbət edilən kitabın müəllifi möminlərin əmiri Əli bin Əbi Talibə yaxın biri olduğunu, onun yanında silahdaşı olduğunu deyir. Lakin o dövrün hadisələrini qələmə almış və ya o dövr haqqında xəbərlər toplamış müəlliflərin heç biri tarixi bir şəxsiyyət olaraq Süleymin mövcud olduğuna dair heç bir dəlil və ya işarə təqdim etmirlər. əl-Yaqubi'nin tarixinə, İbn Sad'ın "Tabəqat" kitabına, əl-Vaqidi'nin "əl-Məğazi" kitabına, əl-Bələzuri'nin "Ənsəbul-Əşraf" və "Futuhul-Buldən", ət-Tabəri'nin tarixi, Muhəmməd bin Həbib əl-Bağdadi'nin "əl-Mihbər" kitabına, Əbu Mixnəf'in "Məqtəl əl-Hüseyn", Nəsr bin Muzəhim'in "Vaqatus-Siffin" kitabına nəzər saldığımızda Əlinin, Həsənin və Hüseynin yoldaşları və silahdaşları arasında belə bir şəxs haqqında heç bir məlumat yoxdur. Ona görə də İbn Əbil-Hədid yazır: "Süleym ibn Qeys əl-Hilalinin rəvayətinə gəlincə, bu rəvayət etibarsızdır və heç bir dəyəri yoxdur. Süleym isə məzhəbi məşhurdur (yəni şiədir). Onun rəvayətini rədd etmək üçün şiələrin arasında məşhur olan "Süleymin Kitabı" özü kifayət edir. Üstəlik, mən bəzi şəxslərdən eşitmişəm ki, bu adın (yəni Süleym ibn Qeys adının) heç bir gerçək daşıyıcısı olmayıb, yəni dünyada Süleym bin Qeys adı ilə tanınan bir şəxs mövcud olmayıb və ona nisbət verilən kitab uydurma və əsassızdır, heç bir təməli yoxdur — baxmayaraq ki, bəziləri onu "Rical" kitablarında ad olaraq zikr ediblər."[1007] Hələ zamanında əl-Mufid özü bu kitaba şəkk edirdi, beləki əs-Saduq'un "Etiqadət" kitabına yazdığı

[1005] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 2/139;

[1006] İbnul-Ğadəiri, "ər-Ricəl", səh: 63;

[1007] İbn Əbil-Hədid, "Şərh Nəhc əl-Bələğa", 12/216-217;

şərhində deyir: “Bu kitab etibarlı deyil və onun böyük əksəriyyətinə əsaslanmaq caiz deyil. Kitabda qarışıqlıq və tədlis var. Buna görə də, dindar bir şəxs bu kitabda olan hər bir şeyə əməl etməkdən çəkinməlidir və bütövlükdə ona etimad etməməlidir.”[1008]

əl-Behbudi deyir ki, “kitab uydurmadır, onu ğulat əhlindən bir nəfər Suleym bin Qeys əl-Hiləli’nin dilindən, İbn Uzeynə’nin Əbən bin Əbi Ayyəş’dan rəvayəti ilə uydurub. (Kitabı uyduran şəxs kitaba ravi olaraq) Ömər bin Uzeynə’ni isə yalnız ona görə seçib ki, çünki abbasi xəlifəsi əl-Mehdi’nin xəlifəliyi dönəmində (h. 158-168) onun şərrindən qurtulmaq üçün öz vətəni Basradan qaçaraq Yəmən bölgələrinə sığınmışdı. Orada da öldü, beləliklə də bu kitabı yazan zındıq öz əlyazmasını götürərək Kufədə, Basrada və Yəməndə qafil kitab tüccarlarının əllərinə soxmağı bacarıb və şiə ravilər bunu götürüb vicadə (tapılmış kitab) yolu ilə, Ömər bin Uzeynə’nin rəvayətləri üçün özlərində olan icazələr kanalı ilə - nüsxələri təhqiq etmək, onu İbnUzeynə’nin özünə oxumaq imkanı olmadan - rəvayət etməyə başlayıblar. Bütün bunları əhli beytin düşmənlərini pisləmək, onların nüfuzuna zərər vurmaq sevdası ilə ediblər.”[1009] Belə çıxır ki, əl-Behbudi’yə görə bu kitab ya ikinci əsrin sonlarında, ya da üçüncü əsrin əvvəllərində uydurulub. Kitab uydurma olmaqdan əlavə bir çox təhriflərlə də üzləşib, çünki kitabın nüsxələri arasında xeyli fərqlər mövcuddur, ona görə də bu gün əlimizdə olan kitabın o dövrdə tanınmış kitabla eyni olduğunu bilmək mümkün deyildir. Bunu Əbul-Qasim əl-Xoyi, Cavad ət-Təbrizi və başqaları deyirlər.[1010]

**Mufəddal’ın tövhidi** adı ilə şiələr arasında yayılmış və məşhurlaşmış kitab isə başqa bir misaldır. Süleym bin Qeys’dən fərqli olaraq Mufəddal bin Ömər əl-Cufi’nin real tarixi şəxsiyyət olmasına dair əlimizdə kifayət qədər dəlil var. Bu kitabın Cəfər əs-Sadiq – Allah ondan razı olsun – tərəfindən Mufəddal bin Ömərə imla etdiyi iddia olunur. Bu kitabı ilk dəfə bu şəkildə nisbət verənlərdən biri ən-Nəcaşi (h. 450) olmuşdur. O, "ər-Ricāl" əsərində bu kitab haqqında yazır: “”Mufəddal bin Ömər; (kunyəsi) Əbu Abdilləh’dir, Əbu Muhəmməd olduğu da deyilib. Nisbəti əl-Cufi’dir, kufəlidir. Fasid məzhəb sahibidir, rəvayəti iztirablıdır, ona (bir ravi kimi) etibar edilməz, deyilib ki, o,

---

1008 əl-Mufid, “Təshih İtiqadət əl-İməmiyyə”, səh: 149;

1009 əl-Behbudi, “Mərifətur-Ricəl”, səh: 363-364;

1010 bax: əl-Xoyi, “Siratun-Nəcət”, 5/279; ət-Təbrizi, “əl-Ənvar əl-İləhiyyə fil-Məsəil əl-Aqadiyyə”, səh: 254;

xəttabi olub. Mən ona aid etimad olunmayacaq əsərlər zikr etmişəm. Bunu yalnız daha əvvəl qoyduğumuz şərtə görə zikr etmişik."[1011] Bu o deməkdir ki, ən-Nəcəşi özünə belə bir şərt qoymasaydı bu kitabı ümumiyyətlə qeyd etməzdi. Daha sonra Mufəddal'a nisbət etdiyi kitabların adlarını qeyd edir və onların arasında "Kitəbu Fəkkir; Kitəbun fil-Bəd'il-Xalqi val-Həssi aləl-İtibar" adı ilə tanıtdığı bir kitabı da qeyd edir. Bu, məhz bu gün "tövhid" adı ilə tanınan eyni kitabdır. Rahatlıqla deyə bilərik ki, hicri beşinci əsrə qədər şiə müəlliflər arasında bu kitab haqqında heç bir məlumat olmayıb və bunu ilk dəfə şiə kitabları arasında qeyd edən ən-Nəcaşi olub. Onun müasiri Şeyxut-Taifə ət-Tusi "əl-Fihrist" kitabında belə bir kitabın olduğunu yazmır. ən-Nəcəşi'dən sonra bu kitabı Ibn Tavus (h. 664) zikr edir və onu tərifləyir. "Kəşful-Məhəccə" kitabında deyir: "Allah-Təalanın yaratdığı varlıqlar barəsində İmam Sadiq'in - aleyhissalam - Mufəddal bin Ömərə imla etdiyi kitabına baxın."[1012] Bir başqa kitabında səfərə çıxan birinə özü ilə birlikdə oxumaq üçün götürəcəyi kitabları məsləhət görərkən yazır: "Onunla yanaşı əl-Mufəddal bin Ömər(in kitabı)nı götürsün, onu əs-Sadiq'dən - aleyhissalam - rəvayət edir; aşağı aləmin yaradılışında hikmətin yönlərini tanımaq və onun sirlərinin aşkara çıxarılması (barədədir). Çünki bu əsər məna baxımından çox gözəldir."[1013] Görünür ki, bu dövrdə kitabın müəyyən bir adı olmayıb, ona görə də fərqli fərqli mənbələrdə fərqli adlarla zikr olunur. əl-Məclisi (h. 1111) bu kitabı olduğu kimi "*Biharul-Ənvar*" kitabında qeyd edir, onu kitabının fərqli yerlərində hissə-hissə qeyd edir, bəzi sözlərinə izahlar verir. Kitabı başqaları da şərh ediblər. Son dövrlərdə bu əsər "Təvhidul-Mufəddal" adı ilə məşhurlaşmış və ilk dəfə İran və Hindistanda çap edilmişdir. Müasir dövrdə isə Beyrutda "Müəssəsətul-Vəfa" tərəfindən hicri 1406-cı ildə ikinci nəşr olaraq çap edildikdə əsas referens qaynağa çevrildi. Onun əlyazmaları Əzhər kitabxanasında, Prinston Universitetində, Məşhəd kitabxanasında və başqa yerlərdə mövcuddur.[1014]

Kitabın həqiqi müəllifinin kim olmağından asılı olmayaraq onun məzmunu bizi dərin düşünməyə vadar edir. Əsərin ilkin müəllifi mövzuları elə bir şəkildə qələmə almışdır ki, bunlar onun yaşadığı dövrdə yayılmış elmi biliklərə, xüsusilə tibbi məlumatlara və heyvanlarla bağlı təsəvvürlərə uyğunluq və ahəng təşkil edir. Kitabın müəllifi öz

---

[1011] "Ricəl ən-Nəcəşi", səh: 416;

[1012] İbn Tavus, "Kəşful-Məhəccə", səh: 9;

[1013] İbn Tavus, "əl-Əmən min Əxtar əl-Əsfər", səh: 91;

[1014] Bax: "Tərixul-Ədəbil-Arabi", 1/260-261; "Tərixut-Turas əl-Arabi", 1/270-279;

təqdimatında zamanın hakim fikirlərindən çıxmamış, əksinə, onları olduğu kimi mənimsəmişdir. Məsələn, rüşeymin meydana gəlməsini kişinin nütfəsi ilə qadının aybaşı qanının qarışığı kimi izah etmiş və bu, o dövrdəki yayğın tibbi görüşləri əks etdirmişdir. Habelə əjdaha ilə pələngin təbiəti arasındakı əlaqəyə dair söylədikləri qədim ərəb inanclarını və folklorunu xatırladır, beləliklə də əsər, dövrünün mədəni və elmi təsəvvürlərini aydın şəkildə özündə əks etdirir. Kitabda diqqətçəkən mövzulardan biri də Aristotelə edilən istinadlardır. Çünki Aristotelin əsərlərinin geniş yayılması tərcümə hərəkatının canlandığı dövrə, xüsusilə də Abbasi xəlifəsi Məmun və ondan sonrakı dövrlərə təsadüf edir. İmamın sözlərini Aristotelə dayandırmaq şiə hədis ənənəsində olduqca qəribə və nadir bir hadisədir, bənzəri yoxdur.

Məsələ burasındadır ki, bu kitab eyni zamanda mötəzili alimi əl-Cahiz'ə də nisbət olunub; İbnun-Nədim "əl-Fihrist" kitabında, Yaqut əl-Həməvi "İrşədul-Ərib" kitabında, İbnul-Vəzir "İsərul-Haqq" və "əl-Avasim" kitablarında[1015] bunu əl-Cahizə nisbət edirlər. Ümumiyyətlə Yəmənin zeydi şiələri arasında əl-Cahiz'in kitablarına xüsusi maraq və qayğı göstərilir, ona görə də bu kitabın əl-Cahiz'ə nisbət edilən əlyazmaları ən çox orada yayılıb. Hələbdə 1928-ci ildə "əl-Dəlail val-İtibar" adı ilə əl-Cahiz'in kitabı olaraq çap olunanda təhqiq üçün əsas götürülən əlyazmalar çoxunluqla Yəməndə tapılmışdı. Kitab bundan əvvəl Misirdə əl-Əmiriyyə mətbəəsində 1914-cü ildə nəşr olunmuşdu. Lakin bu kitab əslində nə əl-Mufəddal bin Ömərə, nə də mötəzili alimi əl-Cahiz'ə aid deyildir. əl-Mufəddal bin Ömərə, dolayısıyla İmam Cəfərə nisbət edilməsinə gəldikdə şiə alimi Seyyid Muhəmməd Rida əs-Sistani yazır: "Bu kitabın əl-Mufəddal'a nisbətinə gəldikdə isə bu barədə uzun bir söhbət var. Professor Mustafa Cavad bunun əl-Cəhiz'ə aid olduğunu iddia edib və həqiqətən də səksən il bundan əvvəl, ya da daha da keçmişdə onun adı ilə çap olunub. Bu mövzuya burda daxil olmaq imkanımız yoxdur, lakin burada qeyd edilməsi lazım olan budur ki, bu kitabda varid olmuş bəzi şeylərin Məsumdan sadir olduğunu təsdiqləmək çətindir…" Daha sonra əs-Sistani bunun misallarını verir və əlavə edir ki, "xüsusilə kitabın müqəddiməsi və dördüncü məclis, geniş bir ölçüdə ismaili etiqadlarına bənzəyir."[1016] Kitabın əl-Cahizə aid olmasına gəldikdə isə Həsən əs-Sundubi "Ədəbul-Cahiz" kitabında

---

[1015] Bax: İbnud-Nədim, "əl-Fihrist", səh: 211; əl-Həməvi, "İrşədul-Ərib", 5/2119; İbnul-Vəzir, "İsərul-Haqq", səh: 169; "əl-Avasim val-Qavasim", 4/33, 37; əş-Şəvkəni, "Fəthul-Qadir", 5/567;

[1016] əs-Sistani, "Qabəsət min İlm ər-Ricəl", 1/563-565;

buna şəkk edir və kitabın üslubunun əslində əl-Cahizin üslubu olmadığını təsdiqləyir. Əslində - əlimizdəki ən etibarlı məlumatlara əsasən - kitabın həqiqi müəllifi iraqlı nestorian xristianlarından Cibril bin Əbi Nuh əl-Ənbəri'dir. Muhəmməd Kazim Rəhməti bu barədə məqaləsində deyir: "Lakin aydın olan budur ki, bu kitab, böyük ehtimalla, hicri III və ya IV əsrdə yaşamış bir şiə alimi tərəfindən - güman ki, Əli ibn Hatim əl-Qəzvini tərəfindən - qələmə alınmışdır. Bu alim "Fəkkir" kitabının qısa redaktə versiyasından (yəni ilk redaksiyasından) istifadə etmişdir. Bu kitab Cibrill ibn Nuh əl-Ənbəri'yə aiddir və "müfəssəl redaktə" adlanan sonrakı versiyadan fərqlidir. Daha sonra əl-Mufəddal'ın adı məşhur olduğuna və İbn Əbi-l-Əvca ilə bağlı rəvayətlər çox olduğuna görə bütün bu mətnlər bir araya gətirilmiş və "Tövhid-i Müfəddəl" adı altında toplanmışdır."[1017] Mushegh Asatryan da təsdiq edir ki, əl-Mufəddal'a nisbət edilən "tövhid kitabı əslində ədəbiyyatşünas əl-Cahiz'ə nisbət edilmiş "Kitəb əd-Dəlail val-İtibər aləl-Xalq vat-Tədbir" adlı mötəzili əsərinin şiə adaptasiyasıdır və Van Ess'in dediyinə görə "əd-Dəlail" kitabı özü də hicri 3, miladi 9-cu əsrə aid xristian müəllif Cibril bin Əbi Nuh əl-Ənbəri'nin nəşr olunmamış "Kitab əl-Fikr val-İtibar" kitabının adaptasiyasıdır."[1018] Həqiqətən də bu gün əlimizdə olan ən qədim əlyazmaların üzərində müəllif olaraq bu nestorian xristianın adı qeyd olunmaqdadır.

**Həsən əl-Askəri'nin təfsiri** göstərə biləcəyimiz bir başqa misaldır. əs-Saduq kitablarının çoxunda, ət-Tabrasi "əl-İhticac" kitabında, Qutbuddin ər-Ravəndi "əl-Xaraic" kitabında, İbn Şərhiəşub "əl-Mənaqib" və "Məalil-Uləmə" kitablarında, əş-Şəhid əs-Səni "Munyətul-Murid" kitabında, əl-Feyd əl-Kəşəni "əs-Safi" təfsirində, əl-Hurr əl-Əmili "əl-Vasəil" kitabında, Haşim əl-Bəhrani öz təfsirində bu təfsirdən nəqllər gətirirlər.[1019] Muhəmməd Təqi əl-Məclisi bu təfsir haqqında deyir: "İmamların sözləri ilə yaxından tanış olan hər kəs bu kitabın onların sözü olduğunu anlayar. Şeyximiz əş-Şəhid əs-Səni ona etimad etmiş və kitablarında ondan çoxlu rəvayətlər nəql etmişdir. əs-Saduq kimi olan belə bir tələbənin ona etimad etməsi kifayət edir."[1020] Oğlu Muhəmməd Baqir əl-Məclisi isə deyir: "İmamın (əleyhis-səlam) təfsir kitabı tanınmış kitablardandır və Səduq ona etimad etmiş, ondan

---

[1017] Muhəmməd Kazim Rahməti, "əl-Mufəddal bin Ömər va Kitəb ət-Təvhid"; https://nosos.net

[1018] Asatryan, "Controversies in Formative Shi'i Islam", səh: 59;

[1019] Bax: "Təfsir əl-İmam əl-Askəri", səh: 688-693

[1020] əl-Məclisi, "Ravdatul-Muttəqin", 14/250;

rəvayətlər götürmüşdür. Hərçənd bəzi mühəddislər bu kitaba tənə vursalar da, mərhum Səduq onların hamısından daha agah və o kitaba zaman baxımından daha yaxın olmuşdur. Bu kitabdan çoxlu alimlər rəvayət etmiş və ona qarşı bir irad bildirməmişlər."[1021] əl-Vahid əl-Bəhbəhəni də "Minhəcul-Məqal" kitabına yazdığı qeydlərində Muhəmməd Təqi əl-Məclisi'nin sözlərini nəql edərək təsdiqləyir.[1022] Həmçinin Hüseyn əl-Burucurdi deyir: "Cəlil imam Həzrət Həsən ibn Əli əl-Askəri'yə — ona, atalarına və onun qeybə çəkilmiş hüccət övladına ən üstün salavatlar olsun — nisbət edilmiş təfsir kitabının sənədi onun əvvəlində qeyd olunmuşdur. Bu kitabın imamiyyə şiələri arasında məşhur olması, onların onu qəbul ilə qarşılaması və onun rəvayətlərini bir çox kitab və üsulda nəql etmələri bizim üçün bu kitabın ravilərinin halları (etibarlılığı) barədə düşünmək zəhmətini aradan qaldırır."[1023] Bu və buna bənzər nəqllərlə dolu olun şiə kitablarında İmam əl-Askəri'nin təfsiri mötəbər bir qaynaq kimi qəbul olunur.

Lakin bununla belə şiə alimlərinin ciddi bir hissəsi bu nisbətin doğru olmadığını, bu təfsirin İmamın adından uydurulmuş bir kitab olduğunu deyiblər. Misal üçün Əbul-Qasim əl-Xoyi deyir: "İmam əl-Askəri'yə nisbət olunan təfsir bu adamın və onun yoldaşı Yusuf bin Muhəmməd bin Ziyad'ın rəvayəti ilədir və hər iki nəfərin halı məchuldur. Onların özlərinin imamdan - aleyhissələm - onların halına ehtimam göstərməsi ilə bağlı rəvayət etdiklərinə etibar edilməz… Bununla yanaşı bu təfsirə nəzər salan kəs onun uydurma olduğunda şəkk etməz. Mühəqqiq bir alim belə bir təfsir yazmaz, o zaman İmamın yazması necə mümkündür?!"[1024] Şeyx Muhəmməd Cavad əl-Bələği deyir: "İmam Həsən əl-Askəri'yə - aleyhissələm - nisbət verilən təfsirə gəlincə isə, biz bu təfsirin vəziyyəti barəsində ayrıca bir risalədə açıqlamışıq ki, o, uydurulmuş və iftira olunmuş bir əsərdir. Bunu göstərən dəlillərdən biri də elə təfsirin özündə yer alan ziddiyyətlər və hər iki ravinin sözlərindəki, həmçinin onların rəvayət adlandırdıqları mətnlərdəki uyğunsuzluqdur. Üstəlik, bu təfsirdə Qurani-Kərimə və tarixdə məlum olan hadisələrə zidd olan məqamlar vardır."[1025] Muhəmməd Təqi ət-Tustəri bu təfsirin əl-Askəri'yə nisbətinin böhtan və iftira olduğunu yazır və bunun üçün uzun-uzadı dəlillər ortaya

---

[1021] əl-Məclisi, "Bihərul-Ənvar", 1/28;

[1022] əl-Bəhbəhəni, "Təliqa alə Minhəcil-Məqal", səh: 326;

[1023] əl-Burucurdi, "Təfsir əs-Sirat əl-Mustəqim", 1/214;

[1024] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 13/157;

[1025] əl-Bələği, "Ələur-Rahmən fi Təfsir əl-Quran", 1/49;

qoyur.[1026] Mirzə Əbul-Həsən əş-Şərani "Məcmə əl-Bəyan" kitabına yazdığı haşiyəsində bu təfsirin içindəki tarixi və digər xətaları qeyd edir və sonra yazır ki, "bu kitabı uyduranın tarixdən xəbəri olmayıb."[1027] Bununla belə əs-Saduq, əl-Məclisi, ət-Tabərsi və başqaları - yuxarıda qeyd etdiyimiz kimi - bu təfsir kitabına etimad edib ondan rəvayət edirlər. Belə görünür ki, bu təfsir kitabı əksər şiə alimlərinin kitablarında bir qaynaq olaraq istifadə edilib.

"**Misbahuş-Şəriə**" kitabı İmam Cəfər əs-Sadiq'ə nisbət edilən bir kitab olaraq burada qeyd edilməyə layiqdir. Maraqlıdır ki, hicri yeddinci əsrə qədər şiə ədəbiyyatında bu kitab haqqında heç bir xəbər olmayıb. Belə bir kitabın olduğunu ilk dəfə qeyd edən şiə alimi İbn Tavus olub, beləki səfərdə götürülməsi məsləhət olan kitablar haqqında danışarkən edir: "(İmam) əs-Sadiq'dən gələn "Misbəhuş-Şəriə va Miftəhul-Həqiqa" kitabını da özü ilə götürsün, çünki bu kitab Allaha - cəllə cəlaluhu - doğru süluk etməyi, Ona yönəlməyi izah edən kişik və şərəfli bir əsərdir."[1028] Bundan sonra bu kitab şiə müəlliflər arasında tədavülə keçmiş və ondan iqtibaslar gətirilmişdir. Şeyx İbrahim bin Əli əl-Kəf'ami "Məcmu əl-Ğaraib" kitabında bu kitabdan istifadə edir. əş-Şəhid əs-Səni də kitabında burada tam bir fəsli qeyd edir və sonra deyir: "Bu fəslin hamısı əs-Sadiq'in sözündəndir."[1029] Muhəmməd Təqi əl-Məclisi də oxuyucuya belə bir məsləhət verir: "Sənə "Misbəhuş-Şəriə" kitabını tövsiyə edirəm; onu əş-Şəhid əs-Səni isnadları ilə əs-Sadiq'dən rəvayət edib və mətni onun səhihliyinə dəlalət edir."[1030] əl-Qadi Said əl-Qummi əs-Saduq'un "ət-Tövhid" kitabına yazdığı şərhində, əş-Şeyx əl-Huveyzi təfsirində, Şeyx Əhməd Al Ta'an əl-Bəhrani "ər-Rasəil əl-Əhmədiyyə" kitabında və başqaları öz kitablarında "əl-Misbəh" kitabından nəqllər gətirirlər. Mirzə ən-Nuri ət-Tabrasi "Xatimətu Mustədrak əl-Vasəil" kitabında "əl-Misbəh" kitabının İmam əs-Sadiq'ə nisbət olunmasını müdafiə edir və qeyd edir ki, İbn Tavus, əl-Kəf'ami, əş-Şəhid əs-Səni, Seyyid Hüseyn əl-Qazvini, Muhsin əl-Qasəni və başqaları bu kitabın əs-Sadiqə nisbətini doğrulayıblar. Daha sonra gətirilmiş etirazlara cavablar verməyə başlayır.[1031] Lakin "Misbəhuş-Şəriə" kitabı xeyli sayda şiə alimlərin nəzərində mötəbər və əs-Sadiqə

---

[1026] ət-Tustəri, "əl-Əxbərud-Dəxilə", 1/152;

[1027] ət-Tabrasi, "Məcmə əl-Bəyan", 10/580;

[1028] İbn Tavus, "əl-Əmən min Əxtar əl-Əsfər val-Əzmən", səh: 91-92;

[1029] əl-Amili, "Musəkkin əl-Fuəd ində Fəqdil-Əhibbəti val-Əvləd", səh: 58;

[1030] əl-Məclisi, "Ravdatul-Muttəqin", 19/422;

[1031] ən-Nuri, "Xatimətu Mustədrak əl-Vasəil", 1/194-198;

nisbəti səhih kitab kimi qəbul görsə də əl-Askəri'nin təfsiri kimi güclü dəstək qazanmayıb, amma bununla belə şiə ədəbiyyat mirasına sızmış və kitablarda nəqllərlə yad edilmiş bir kitabdır. Bununla belə əl-Hurr əl-Amili və Muhəmməd Baqir əl-Məclisi kimi əxbari alimlər belə bu kitabın İmam əs-Sadiq'ə nisbətində şəkk ediblər. əl-Hurr əl-Amili deyir: "Bizim nəzərimizdə mötəməd olmadığı sabit olmuş, ona görə də ondan nəql etmədiyimiz kitablar; bunlardan biri əs-Sadiqə - aleyhissələm - nisbət olunmuş "Misbəhuş-Şəriə" kitabıdır. Çünki onun sənədi sabit deyildir və içində mütəvatirlərə müxalif olan münkər şeylər var."[1032] Muhəmməd Baqir əl-Məclisi də öz atasına müxalif olaraq deyir: "Misbahuş-.əriə kitabında ağıllı və anlayışlı bir şəxsi şübhəyə salacaq bəzi məqamlar vardır. Onun üslubu da imamların digər sözlərinə və əsərlərinə bənzəmir."[1033]

Burada daha maraqlı bir misal da var. Şiələrin yeddinci əsrdə yaşamış alimlərindən olan İbn Tavus (ö. h. 673) bir kitab yazıb və kitabın adını "ət-Taraif fi Mərifəti Məzəhib ət-Tavaif" qoyub. Sözü gedən kitabın girişi belədir: "Mən zimmî bir adamam və bu səbəblə müsəlmanların yanında mənim qorunulmuş statusum var. Buna görə də, müsəlmanların yazdıqlarıma görə məni qınamağa tələsməməkləri lazımdır; əksinə, qeyd etdiklərimin həqiqəti barəsində düşünməlidirlər. Çünki o qədər qınanılan kəslər var ki, heç bir günahları yoxdur. Mən isə, uşaqlıqdan bəri müxtəlif dinlərə və məzhəblərə mənsub olanların hər zaman bir-birilə ixtilaf etdiyini eşitmişəm. Buna görə, həm nəfsimlə, həm də zehnim, düşüncəm və müşahidə gücümlə inanc və dinləri araşdırmaq üçün səyahətə çıxdım – məqsədim nəfsim üçün qurtuluş əldə etmək, Allahın razılığına və əbədi yurd olan axirət evinə nail olmaq, peşmançılıqdan və Qiyamət gününün təhlükəsindən amanda qalmaq idi. Mən Muhəmmədin – salləllahu aleyhi və alih – və onun dininə tabe olanların nə dərəcəyə çatdıqlarını öyrəndim. Beləliklə, onun gətirdiklərini, ardıcıllarının halını və şəriətini araşdırmağı vacib bildim. Bu araşdırmam nəticəsində İslam əhli arasında ən çox yayılmış olan dörd məzhəbin – malikilərin, hənəfilərin, şafiilərin və hənbəlilərin – olduğunu gördüm. Yəni: Malik məzhəbi, Şafii məzhəbi, Əbu Hənifə məzhəbi və Əhməd ibn Hənbəl məzhəbi..."[1034] Daha sonra bu zimmi bu məzhəbləri tənqid edir və şiəliyin ən doğru olduğunu isbat etməyə çalışır. Kitabda öz adını

---

[1032] əl-Amili, "Hidəyətul-Ümməti ilə Əhkəmil-Əimmə", 8/55;

[1033] əl-Məclisi, "Biharul-Ənvar", 1/32;

[1034] İbn Tavus, "ət-Taraif", səh: 3-4;

Abdulmahmud bin Davud olaraq qeyd edir, sanki kitab əhlindən biridir və tam neytral mövqedən çıxış edərək İslam daxilindəki məzhəblər barəsində öz rəyini bildirir. əş-Şəhid əs-Səni bu ada və kitabın yazılma məqsədinə diqqət çəkir: "Abdulmahmud' adının qoyulmasının səbəbi budur ki, çünki bütün aləm Mahmud (Həmd olunmuş) olan Allahın qullarıdır. 'Davud'a nisbət isə, İmam əs-Sadiqin – aleyhissələm – süd qardaşı olan Həsən oğlu Davuda işarədir. Məşhur 'Ümmü Davud duası'nda adı keçən də məhz odur və o, Seyyid İbn Tavusun babalarından biri sayılır." Müəllif, mövzunu gözəl bir üsulla ortaya qoymuş, özünü İslama daxil olmuş bir zimmî kimi – yəni, müsəlman məzhəblərinin ideoloji təsiri beyninə hopmamış bir şəxs kimi təqdim etmişdir. Çünki insan hansısa bir məzhəbdən yapışaraq onun mühitində böyüyərsə və onlarla yaşarsa, bu hal onu ya təəssübə, ya da kor-koranə bir təqlidə aparar – ata-babaların və çoxluğun yoluna. Belə olan halda onun Qurani-Kərim və Sünnədən qavrayışı düzgün olmaz. Əksinə, o, öz mövcud inanclarının təsiri altında ayələri anlamaya və Qurani-Kərimi mövcud əqidəsinə uyğun təfsir etməyə, əksinə dəlalət edən mətnləri isə təvil etməyə çalışar."[1035] Belə çıxır ki, İbn Tavus özünü neytral göstərmək üçün tamamilə fiktiv bir şəxsiyyətin adından kitab yazıb, özünü neytral biri kimi göstərib və bu üslubla kitabını oxuyacaq şəxsləri aldatmağa çalışıb. Burada maraqlı olan budur ki, şiə alimləri bu həqiqəti gizlətmirlər, əksinə İbn Tavus'un bu əməlini gözəl bir metod hesab edirlər.

Şeyx Muhəmməd Asif əl-Muhsini bəzi kitabların mötəbər sənədlərlə "əl-Vasəil", "əl-Vafi", "Bihərul-Ənvar" və "Mustədrak əl-Vasəil" kitablarının müəlliflərinə çatmadığını deyir. Bu cür kitabların arasında "Əli bin Cəfərin kitabının, əl-Bərqi'nin "əl-Məhəsin" kitabı, Əli bin İbrahim'in təfsiri, əs-Saffər'in "Bəsair əd-Dəracət" kitabı, əl-Hüseyn bin Said'in "əz-Zuhd" kitabı, Əhməd bin Muhəmməd bin İsa'nın "ən-Nəvadir" kitabı, əl-Himyəri'nin "Qurbul-İsnəd" kitabı, əs-Saduq'a nisbət edilmiş bəzi kitablar, Şeyx əl-Mufid'in "əl-Əməli" kitabı və Şeyx ət-Tusi'nin "əl-Əməli" kitabının adlarını çəkir və deyir: "Bu kitabların nüsxələri bu dörd "hədis kitabının" müəlliflərinə mötəbər sənədlə çatmayıb."[1036] Bir başqa kitabda buyurur: "Ana qaynaqlar və referens sayılan hədis kitablarından bir çoxunun nüsxələri öz müəlliflərindən "Bihər əl-Ənvar", "Vasəil əş-Şiə", "əl-Vafi" kitablarının müəlliflərinə mötəbər silsilə sənədlərlə çatmayıb. Əksinə sözü gedən

[1035] "ət-Taraif" kitabının müqəddiməsi (səh: 10)

[1036] Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/14-15;

hədis kitabları həmin hədisləri bazarlardan, kitabxanalardan götürülmüş və yüz illər ərzincə halı məchul olan qaynaqlardan nəql ediblər…"[1037]

## Təqiyyə

Problemin ikinci hissəsi təqiyyə ilə bağlıdır. Uydurulmuş yalan xəbərlər olduğu kimi imamlara nisbət edilmiş xeyli sayda hədislərin təqiyyə olaraq deyildiyi iddia olunur. Bu vəziyyət o dərəcədə gülünc həddə çatıb ki, praktiki olaraq imamlardan gələn istənilən xəbərin təqiyyə olduğunu iddia etmək mümkündür. Əbu Cəfər əl-Uqeyli deyir: "Əbu Yəhya Abdullah bin Əhməd bin Əbi Məsərra bizə rəvayət etdi; dedi: Said bin Mənsur mənə rəvayət etdi; dedi: "İbn əs-Səmmək bizə rəvayət etdi; dedi: "Məkkəyə yola düşdüm və Zurara bin Ayun mənimlə əl-Qadisiyyədə qarşılaşdı və mənə dedi: "Mənim səndən bir istəyim var, səndən onu etməyini xahiş edirəm" və bu istəyinin önəmini vurğuladı. Soruşdum: "Nədir istədiyin?" Dedi: "Əgər Cəfər bin Muhəmməd ilə qarşılaşsan məndən ona salam söylə və ondan mənə xəbər verməsini istə: "Mən cənnət əhlindənəm yoxsa cəhənnəm əhlindən?" Mən onun bu sualını inkar etdim, bunun üzərinə mənə dedi: "O, bunu bilir." O qədər israr etdi ki, axırda razılıq verdim. Cəfər bin Muhəmməd ilə qarşılaşdığımda onun dediklərini xəbər verdim. (Cəfər) dedi: "O, cəhənnəm əhlindəndir." Onun bu dediyi sözdən qəlbimə rahatsızlıq düşdü və soruşdum: "Sən bunu hardan bilirsən?" Dedi: "Kim mənim barəmdə belə bir şeyi bildiyimi iddia edərsə o, cəhənnəm əhlindəndir." Geri qayıtdığımda Zurara bin Ayunla qarşılaşdım və məndən onun istəyi ilə bağlı nə etdiyimi soruşdu. Ona xəbər verdim ki, onun cəhənnəm əhlindən olduğunu mənə xəbər verdi. Bunun üzərinə (Zurara) dedi: "Ey Abdullah, sənə bu verdiyi cavab nurə kisəsindəndir." Dedim: "Nurə kisəsi nədir?" Dedi: "Səninlə təqiyyə edib."1038 Bilmək lazımdır ki, Zuraranın burada iddia etdiyi təqiyyə ümmətin

[1037] Muhsini, "Mucəm əl-Əhədis əl-Mutəbəra", 1/22;

[1038] əl-Uqeyli, "əd-Duafə əl-Kəbir", 2/96-97; Bunu əl-Fəsəvi "əl-Mərifə vat-Tərix" kitabında (2/672) Əbu Bəkr əl-Humeydi'dən, o Məkkənin imamı Sufyan bin Uyeynə'dən, o isə İbn əs-Səmməkdən rəvayət edir. Bu xəbər hər iki isnadı ilə səhihdir.

əksəriyyətinin tanıdığı təqiyyə ilə eyni deyildir. İslam ümməti qorxu və təhlükə qarşısında, yəni zərurət halında təqiyyə etməyin icazəli olduğuna inanır. Başqa cür desək müsəlmanın canına və malına qarşı real bir təhlükə varsa bu məqamda təhlükədən qorunmaq üçün yalan danışmağa icazə verilir. Allah - subhənəhu va təalə - buyurur: "Möminlər möminləri qoyub kafirləri dost tutmasınlar! Bunu edən kimsə (bilsin ki,) Allah ilə (onun) heç bir əlaqəsi yoxdur. Ancaq onlardan (gələn təhlükədən) çəkinməklə ehtiyat (təqiyyə) etməyiniz istisnadır. Allah sizi Özündən çəkindirir. Dönüş də ancaq Allahadır." [3:28] Ayədən də anladığımız kimi təqiyyə, xüsusi bir vəziyyətə görə ümumi külli bir prinsipə edilmiş müvəqqəti istisnadır. İmami şiələrində isə təqiyyə daha geniş bir məna daşıyır və məcburiyyət altında olmaqla və ya zərərdən, təhlükədən qorunmaq üçün xüsusiləşdirilmiş bir rüxsət deyildir. Təqiyyə həmçinin hansısa bir fərdə xas deyildir, ümumən imami şiələrinə aid olan kütləvi bir haldır və müvəqqəti deyildir, on ikinci imam zühur edənə qədər bu hal davam edir. İslam ümmətində təqiyyə bir istisna, bir rüxsət olduğu halda, imami şiələrində bu, - bir çox şiə aliminin dili ilə deyiləsi olsa - vacib hökmündədir. Ona görə də İbn Bəbəveyh əl-Qummi deyir: "Təqiyyə, zalımların dövlətində bizim üzərimizə vacib buyurulmuş bir fərzdir, beləliklə də hər kim onu tərk edərsə imami şiələrin dininə müxalif olmuş və ondan ayrılmışdır. (Cəfər) əs-Sadiq deyib: "Əgər desəm ki, təqiyyəni tərk edən namazı tərk edən kimidir doğru söyləmiş olaram." Daha sonra deyir: "Təqiyyə vacibdir, əl-Qaim çıxana qədər onu tərk etmək icazəli deyildir…"1039 Bu qaydaya əsasən on ikinci imam zühur edənə qədər imami şiəsinin təqiyyəni tərk etməsi icazəli deyildir, hətta həyatına və malına heç bir təhlükə olmadığı təqdirdə belə yalan danışması, təqiyyə etməsi onun dininin vaciblərindəndir. Hətta Cəfər əs-Sadiq'ə nisbət etdikləri bir rəvayətdə deyir: "Təqiyyə edin, beləki zərərindən qorxduğu kəslərə qarşı təqiyyə etmək onun səciyyəvi xarakterinə çevrilənə qədər zərərindən qorxmadığı kəslərə qarşı təqiyyəni alt və üst paltarı (kimi davamlı) etməyən kəs bizdən deyildir."1040 Yenə Cəfərə nisbət edilən bir başqa xəbərdə buyurur: "Təqiyyə mənim dinimdir və atalarımın dinidir, təqiyyəsi olmayanın dini yoxdur."1041 Həmçinin rəvayət

---

[1039] əs-Saduq, "əl-Hidayə fil-Usul val-Furu", səh: 51-53; Muəssəsətu əl-İməm əl-Hədi, Qum, 1432

[1040] "Əməli ət-Tusi", səh: 293; əl-Amili, "Vasəil əş-Şiə", 16/212; əl-Məclisi, "Bihər əl-Ənvar", 72/395

[1041] əl-Bərqi, "əl-Məhəsin", 1/255; əl-Amili, "Vasəil əş-Şiə", 16/210; əl-Məclisi, "Bihər əl-Ənvar", 2/74;

olunub ki, "dinin onda doqquzu təqiyyədədir, təqiyyəsi olmayanın dini də yoxdur. Nəbiz içmək və xuflara məsh çəkməkdən başqa hər şeydə təqiyyə vardır."1042 Rəvayətlərin birində isə "təməttu həcci" də istisna edilir.1043 Beləliklə də bu xəbərlərə əsaslanan imami şiələri təqiyyə məsələsini sünnət əhlindəki zərurətlə bağlı rüxsət ölçülərindən kənara çıxararaq onu öz məzhəblərinin özəlliklərindən birinə çeviriblər. Ona görə də təqiyyə, imami şiələrdə iki fərqli ölçüdə mövcuddur. Birinci ölçüsü ümmətin digər qruplarında olduğu kimi qorxu halında istifadə edilən və zərurətdə rüxsət hesab olunan təqiyyədir ki, buna "təqiyyə xəufiyyə" deyilir. İkinci ölçü isə tam əmin-amanlıq olmağına, heç bir zərər və təhlükə olmağına baxmayaraq əsl qəsdini gizlətmək, üzdə batində qəsd etdiyinin əksini izhar etməkdir. Bu ikincisinə "təqiyyə mudəratiyyə" adı veriblər. Müasir dövrün ən böyük mərcilərindən sayılan Əbul-Qasim əl-Xoyi deyir: "Ümumi mənada təqiyyəyə gəldikdə o, əsl etibarı ilə caiz və halaldır. Bu, zərəri dəf etmək qaydasına və "məcbur olanların üzərindən (qələmin) qalxması" hədisinə və zərurət halında Allahın bütün haramları halal etməsi barədə gəlmiş xəbərlərə, zərurətdə istənilən əməlin halal olmasına dəlalət edən digər dəlillərə əsaslanır. Beləliklə də mükəlləfin zərərinə görə və məcbur olduğu üçün etdiyi hər bir əməl pak şəriətdə icazəli və halal hökmündədir.

Amma xüsusi mənada təqiyyəyə, yəni ümumən müsəlmanlara qarşı təqiyyəyə gəldikdə isə bu, əsl etibarı ilə vacibdir. Bu, təqiyyənin vacibliyinə dəlalət edən çox sayda xəbərlərə əsaslanır, hətta bu xəbərlərin mucməl olaraq mütəvatir həddinə çatdığı iddiası var, onlardan bəzilərinin imamlardan sadir olduğunu əminliklə bilirik, ən azından mutməin dərəcəsindən aşağı deyildir. Bu rəvayətlərin arasında İbn Əbi Yafur'un və Məmər bin Xallədin iki səhih rəvayəti, Zurara'nın səhih rəvayəti və təqiyyənin vacibliyinə dəlalət edən digər xəbərlər vardır. Onlardan bəzilərində "təqiyyə mənim və atalarımın dinidir, təqiyyəsi olmayanın dini yoxdur" şəklində gəlir. Görəsən bunun vacibliyinə dəlalət edə biləcək bundan da güclü təbir ola bilərmi?! Bələki burada təqiyyəsi olmayanın din sahibi olduğu başdan ayağa inkar olunur. Buradan təqiyyənin şəriət sahibinin nəzərində əhəmiyyəti aşkar şəkildə görünür və onun vacibliyi o dərəcədədir ki, onu tərk edən dinsiz hesab olunmuşdur. Bəzi xəbərlərdə isə "təqiyyəsi olmayanın dini yoxdur" deyir və bu, vacibliyə dəlalətdə əvvəlki rəvayət kimidir. Üçüncü rəvayətdə isə "əgər təqiyyəni tərk edənin namazı tərk edən kimi

---

[1042] əl-Kuleyni, "əl-Kəfi", 2/217;

[1043] əl-Kuleyni, "əl-Kəfi", 3/32; ət-Tusi, "Təhzibul-Əhkəm", 1/362;

olduğunu desəm doğru demiş olaram" sözləri keçir və bunun da vaciblik mənasına dəlaləti aşkardır, çünki xəbərlərdə qeyd olunduğuna əsasən namaz küfr ilə imanın arasını ayırır. Dördüncü rəvayətdə "təqiyyəni alt və üst paltarı şəklinə salmayan bizdən deyildir" gəlib. Bu rəvayətlərdən bəzilərində təqiyyəni tərk edən kəslər imamların sirlərini ifşa edənlər, onları düşmənlərə xəbər verənlərlə eyniləşdirilir. Bu cür digər rəvayətlər də vardır. Beləliklə də təqiyyə əsl etibarı ilə vacib hökmündədir."[1044] Belə görünür ki, şiələrdəki bu xüsusi təqiyyə növü rüxsət yox, vacib hökmündədir. Əslində bu təqiyyə fikrinin ortaya çıxma səbəblərini anlamaq çətin deyildir. Muhəmməd əl-Baqir və Cəfər əs-Sadiq zamanından başlayaraq onların adından o qədər yalan yayılırdı ki, bu alimlər onların adlarından yayılan bu yalanları alənən inkar etməyə məcbur olurdular, onların yanına daxil olan çox sayda kufəlini lənətləyir, onları yalanlayırdılar. Bu problemə qarşılıq olaraq bəzi şiələr bu təqiyyə məsələsini ortaya atdılar; guya imamlar bu dediklərini təqiyyə olaraq deyirlər, həqiqi mənalarını qəsd etmirlər. İbnus-Səmmək'in Zurara kimi birindən bizə nəql etdiyi xəbər bunun misallarından biridir; əgər bu imamların sözlərindən hansısa biri onların adından yayılan yalanları ifşa edəcəksə o zaman dərhal bu sözlərin təqiyyə olaraq deyildiyini iddia edəcəklər.

Lakin şiələrdə geniş şəkildə yayılmış bu "təqiyyə adəti" onlar üçün çox ciddi problemlərə gətirib çıxarıb. Çünki imamlar bu şəkildə dedikləri sözlərin bir çoxunu sadəcə olaraq təqiyyə üçün deyiblərsə o zaman xəbərlərdən hansının təqiyyə olaraq, hansının sidq olaraq deyildiyi necə müəyyən ediləcək? Şiələrin bu cür təqiyyə ilə dediyindən şübhələndikləri rəvayətlər o qədər çoxdur ki, bu hal onları heyrətə və iztiraba salıb. Şiələrdə Şeyx əs-Saduq adı ilə tanınan alimin atası Əli bin əl-Hüseyn bin Bəbəveyh əl-Qumi (vəfatı h. 329) yazır: "Qeybə çəkilməyə ehtiyac olduğu üçün xəbərlərin sayı çoxaldı və özünü qorumaq üçün təqiyyə etmək səbəbi ilə rəvayətlərə ixtilaf düşdü…Əgər təqiyyə və qorxu olmasaydı heç kim heyrətə düşməzdi, iki nəfər ixtilaf etməzdi…"[1045] Şiələrin mühəddislərindən Yusuf əl-Bəhrani etiraf edir ki, "dinin hökmlərindən az bir hissəsindən başqa heç bir şey yəqinliklə bilinmir, çünki (imamın) xəbərləri təqiyyə xəbərləri ilə qarışıb. Necə ki, bunu Muhəmməd bin Yaqub əl-Kuleyni "əl-Kafi" toplusunda etiraf edir… İmamlar özlərini və şiələrini qorumaq üçün verdikləri hökmlərdə

---

[1044] əl-Xoyi, "ət-Tənqih fi Şərh əl-Urvatil-Vusqa", 5/221-223;

[1045] əs-Saduq əl-Əvvəl, "əl-İmamə va ət-Təbsira minəl-Heyra", səh: 9-10; Mədrəsətul-İmam əl-Mehdi, Qum, 1404

ixtilaf etdilər, hətta onların hüzurunda heç kim olmasa belə görürsən ki, bir məsələdə bir-neçə fərqli, hətta müxaliflərdən heç kimsənin vermədiyi cavablarla cavab verirlər. Onların hekayələrini, xəbərlərini yaxından izləyən, onların həyat tarixlərini və özlərindən sonra qoyduqları əsərləri araşdıranlar bunu çox yaxşı bilirlər."[1046] Bəlkə şiələrdən kimsə "əl-Bəhrani əxbarilərin şeyxidir" deyib bu sözlərə etiraz edə bilər. Həqiqət budur ki, bu faktı üsulilərin alimləri də bilirlər və etiraf edirlər. Misal üçün Muhəmməd Baqir əl-Vahid əl-Bəhbəhəni deyir ki, "onlardan gələn xəbərlərin müxtəlif olmasının səbəblərindən biri - hətta ən əsası - təqiyyədir."[1047] əl-Bəhrani isə əl-Bəhbəhəni'dən fərqli olaraq ixtilafın hamısının səbəbini təqiyyə ilə bağlayır. İmami şiələrin əksəriyyəti əl-Bəhrani ilə razılaşmırlar və imamlardan rəvayət olunmuş xəbərlər arasındakı ixtilafın səbəblərinin birdən çox olduğunu yazırlar, amma bununla belə hamısı qəbul edir ki, təqiyyə bu səbəblərin ən əhəmiyyətlilərindəndir.

Gördüyümüz kimi əl-Bəhrani bu dəhşətli problemi heç bir şeyi gizlətmədən etiraf edir və altının xəttini cızaraq deyir ki, imamlar təkcə düşmənlərinin hüzurunda təqiyyə etməyiblər, ümumiyyətlə normal hallarda da təqiyyə ediblər. əl-Bəhrani bu dediklərini isbat etmək üçün bəzi rəvayətlərə yer verir. Bu rəvayətlərdən birincisini "əl-Kafi" kitabında muvassəq isnad ilə Zurara'dan gətirir ki, orada Zurara İmam Muhəmməd əl-Baqirə sual verir. Zurara "deyir: "Ondan bir məsələni soruşdum və mənə cavab verdi. Sonra onun yanına başqa bir nəfər gəldi və eyni məsələni soruşdu, ona isə mənə verdiyi cavabdan fərqli bir cavab verdi. Sonra bir başqa nəfər gəldikdə ona da mənə və ikinci adama verdiyi cavabdan tamamilə fərqli bir cavab verdi. Sonra hər iki adam onun yanından çıxıb getdikdə soruşdum: "Ey Peyğəmbər övladı, İraq əhlindən olan o iki nəfər sizin şiələrinizdəndir, gəlib sizə sual verdilər, onların hər birinə niyə fərqli cavablar verdiniz?" Dedi: "Ey Zurara, bu, bizim üçün daha xeyirli və sizin üçün daha salamat olandır. Əgər bir rəy üzərində icma etsəniz insanlar sizin bizim haqqımızda dediklərinizi doğrulamış olardılar, o zaman bu, bizim və sizin salamat qalmağımız üçün daha pis olardı." Dedi: "Sonra mən Əbu Abdilləhə - aleyhissələm - bunu ərz etdim: "Siz şiələrinizi nizələrə qarşı və ya atəşə qarşı göndərsəniz hamısı (bir bütöv olaraq) gedərlər, amma sizin

---

[1046] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira fi Əhkəm əl-İtra ət-Tahira", 1/5 ; Dar əl-Ədva, Beyrut, 1405

[1047] əl-Bəhbəhəni, "əl-Haşiyə alə Mədərik əl-Əhkəm", 2/204; Muəssəsətu Al əl-Beyt, Məşhəd, 1419;

yanınızdan çıxdıqlarında ixtilaf etmiş olaraq çıxırlar." (Zurara) dedi: "O mənə atasının verdiyi cavabın eynisini verdi."[1048] əl-Bəhrani bu rəvayəti qeyd etdikdən sonra deyir: "Tək bir məsələdə eyni məclisdə onun - aleyhissələm - cavablarının müxtəlifliyi və Zurara'nın təəccüb etməsi barədə bu xəbərin mənasının aydınlığına nəzər sal! Əgər ixtilaf sadəcə qeyri-şiələrə müvafiq olmaq üçün baş vermiş olsaydı o zaman onlara müvafiq olan tək bir cavab vermək kifayət edərdi və Zurara buna təəccüblənməzdi, çünki o, imamların bəzən ümumi müsəlmanlara (yəni sünnilərə) müvafiq şəkildə fətva verdiklərini bilirdi. Bunun izahı möhtəməl budur ki, şiələr onların hüzurundan ixtilaf etmiş şəkildə, hər biri öz imamından digərinin nəql etdiyindən fərqli bir şey nəql edərək çıxarlarsa, onların məzhəbləri ümumi müsəlman kütləsinin (yəni sünnilərin) nəzərində gülünc hala düşər və (sünnilər) onları nəql etdiklərində yalanlamış olarlar; onları cahilliyə və dinsizliyə nisbət edərlər və onların nəzərində dəyərsizləşərlər. Amma əksinə sözləri bir olsaydı, dedikləri bir-birilərini dəstəkləmiş olsaydı, (müxalifləri) onların dediklərini təsdiqləmiş olardılar və onlara qarşı, imamlarına və məzhəblərinə qarşı nifrətləri şiddətlənərdi və bu, onların düşmənliklərinin şiddətlənməyinə gətirib çıxarardı..." Daha sonra əl-Bəhrani deyir: "Bura həmçinin Şeyxin "ət-Təhzib" kitabındakı - zahirən - səhih rəvayətdə Səlim bin Əbi Xadicə'dən, o da Əbu Abdilləhdən rəvayət etdiyi xəbər də aiddir ki, orada (Səlim) deyir: "Mənim yanımda bir nəfər ondan soruşdu: "Bəzən olur ki, məscidə daxil oluram və əshabımızın bir hissəsi əsr namazını qılır, bəziləri isə zöhrü qılırlar." Dedi: "Onlara bunu mən əmr etmişəm, çünki əgər eyni vaxtda qılsalar onları tanıyarlar və boyunlarını alarlar." Bu rəvayət də biz qəsd etdiyimiz mənaya dəlalətdə aşkardır, beləki bunu ümumi müsəlman kütləyə müvafiq olmaq mənasında izah etməyə yer yoxdur, çünki onlar zöhr ilə əsr vaxtlarını ayırmaqda ittifaq ediblər və davamlı bu şəkildə qılırlar."[1049] Beləliklə də əl-Bəhrani nümayiş etdirir ki, şiələrin imamları normal hallarda, heç bir qorxu olmadığı halda məqsədli şəkildə təqiyyə ediblər və imamlar öz şiələrini məqsədli şəkildə ixtilafa salmaq, onları parçalamaq istəyiblər. Bunun arxasında - iddiaya görə - duran məntiq isə budur ki, parçalanmış, bir-birilərini yalanlayacaq dərəcədə fərqli rəylərə tabe olan, kiçik camaatlara

---

[1048] əl-Məclisi "Mirətul-Uqul" kitabında (1/217) bu xəbər haqqında "səhih kimi muvassəq" hökmü verir.

[1049] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira fi Əhkəm əl-İtra ət-Tahira",1 /5-6 ; Dar əl-Ədva, Beyrut, 1405

bölünən şiələr ümumi müsəlman kütləsinin içində zəif görünəcəklər və beləliklə də onlara əhəmiyyət verilməyəcək. Guya imamlar belə etməklə öz şiələrini təqibdən, əziyyətdən, hətta edamlardan qoruyublar. Şiə alimi əl-Bucnurdi bunu belə ifadə edir: “İmamlar - aleyhimussələm - özlərinin və əshabının fiqhdə xüsusi bir məsləklərinin olmasından, onlara xas fətvaların olmasından qorxurdular, ona görə də özləri öz davamçıları arasında ixtilafı yayırdılar ki, (özlərinə xas bir məzhəb ilə) seçilməsinlər və imamlara mənsub olan xüsusi bir tayfa sayılmasınlar.”[1050] İmamlara nisbət edilmiş bu cür rəvayətlər şiə hədis kitablarında çoxdur. Misal üçün “əl-Kəfi” kitabında keçən belə rəvayətlərdən birində Musa bin Əşyəm deyir: "Mən Əbu Abdullahın - aleyhissələm - yanında idim, o zaman bir adam ondan Allahın Kitabından bir ayə haqqında soruşdu və o, ona izah verdi. Sonra başqa bir adam içəri girdi və həmin ayə haqqında soruşdu, və Əbu Abdullah ona əvvəlki adama dediyinin əksini söylədi. Bu, mənə o qədər narahatlıq verdi ki, sanki qəlbim bıçaqlarla kəsilirdi. Öz-özümə dedim: “Mən Şamda “və” bağlayacısı və bənzərləri kimi kiçik şeylərdə belə səhv etməyən Əbu Qətadəni tərk etdim və bura bunun kimi hər şeydə səhv edən birinin yanına gəldim!” Mən bu düşüncələr içindəyərkən başqa bir adam gəldi və həmin ayə haqqında soruşdu, və Əbu Abdullah ona mənə və əvvəlki şəxsə söylədiklərinin əksini izah etdi. Bu zaman qəlbim sakitləşdi və anladım ki, bunu təqiyyə olaraq edir. Sonra o mənə tərəf döndü və dedi: 'Ey Əşyəmin oğlu, həqiqətən, Allah, azzə va cəllə, Davudun oğlu Süleymana belə demişdi: "*Bu Bizim hədiyyəmizdir. Bunlardan (başqalarına) versən də, verməsən də haqq-hesabı yoxdur*" [38:39], və O, Peyğəmbərinə - salləllahu aleyhi va əlihi - yönəldərək belə demişdir: "*Peyğəmbər sizə nə verərsə, onu alın və nəyi qadağan edərsə, ondan çəkinin*" [59:7]. Allahın Peyğəmbərinə - salləllahu aleyhi va əlihi - verdiyi hər şeyi bizə də vermişdir.”[1051] Allahı şahid tuturam ki, əhlul-beytin böyüklərini və imamlarını onlara nisbət edilmiş bu təqiyyədən tənzih edirəm, onların bu cür insanlara fərqli cavablar verərək batil sözlər söyləməklərini yaraşdırmıram.[1052] Lakin bizi burada

[1050] əl-Bucnurdi, “əl-Qavaid əl-Fiqhiyyə”, 5/351; Mətbəətul-Hədi, 1419

[1051] əl-Kuleyni, “əl-Kəfi”, 1/265-266; əl-Məclisi “Mirətul-Uqul” kitabında (3/148) isnadının zəif olduğunu yazır. Bunu həmçinin əl-Mufid “əl-İxtisas” kitabında (1/329) bunu iki fərqli isnadla rəvayət edir. Bu isnaddakı ravilərin hamısı şiə alimlərinə görə siqadır.

[1052] Şiə hədis kitablarında bu xəbərlərin isnadlarının öz ölçülərinə görə səhih olmasına baxmayaraq bu xəbərlərin imamların adlarına uydurulmuş yalan olmasında şəkk etmirəm. Bunun yalan olmasının ən açıq dəlaləti budur ki, bunu rəvayət edənlər üç fərqli insanın gəlib

maraqlandıran nöqtə imamların həqiqətdə necə davranmış olduqlarını öyrənmək deyildir, imamlara nisbət edilən bu təqiyyə adətinin əqli analiz işığında nə qədər sağlam olduğunu yoxlamaqdır.

Beləliklə də bütün bunları qeyd etdikdən sonra deyə bilərik ki, bu təqiyyə "prinsipi" şiə alimlərini çox ölçüsüz bir yola atıb. Onların içərisində bəziləri demək olar ki, hər xırda şeydən tutmuş ən ağır məsələlərə qədər hər bir şeyi təqiyyə ilə izah etməyə meyl edir. Hətta bəziləri şəriətlə, fətva ilə, etiqad ilə əlaqəsi olmayan tarixi məsələləri də təqiyyə növünə aid edərək izah edirlər. Misal üçün əl-Məclisi "Bihərul-Ənvar" kitabında bu cür tarixi xəbərləri təqiyyə ilə izah edir; Adəmin Yer üzünə endiyi coğrafi məkan, Həvvanın nədən yaradılması, İsmayıl və İshaqın yaşları, Yəhya peyğəmbər ilə İsanın qohumluğu, Yəhya peyğəmbərin ölüm tarixi, İsa peyğəmbərin doğum tarixi və məkanı, Yunus peyğəmbərin balığın qarnında qalma müddəti ilə bağlı xəbərləri təqiyyə ilə izah edir.[1053] Bu misallar bizə şiələrdəki təqiyyə nəzəriyyəsinin hansı dərəcədə geniş və ölçüsüz tətbiq edildiyini göstərir. Beləliklə də şiələrin rəvayət mirasında yalan və uydurma hədislərin geniş şəkildə yayılması birinci problemdirsə, bundan da daha ağır problem təqiyyə problemidir. Çünki əgər imamlar - iddia olunduğu kimi - təqiyyəni bu qədər sərbəst istifadə ediblərsə o zaman daha sonrakı nəsillər imamlara nisbət etdikləri bu rəvayətlərin hansının təqiyyə, hansının haqq olduğunu necə müəyyən edə bilərlər?

Bu işkəl həqiqətən də bir çox şiə zehnini məşğul edib. Əbul-Qasim əl-Xoyi'nin tələbələrindən olan Muhyiddin əl-Ğureyfi yazır: "Hədislərin xeyli bir hissəsi əhlul-beytdən təqiyyə olaraq, şəriət hökmü barədə öz rəylərinə müxalif şəkildə sadir olub. Bunu canları, irzləri və malları zalım xəlifələrin və onların valilərinin zülmündən qorumaqdan ötrü ediblər. Bu cür hədislərin ifadə etdiyi məna imamların həqiqi mənada murad etdikləri məna deyildir. Bəzi xəbərlərdə onlardan rəvayət olunmuş bəzi felləri və təsdiqləri də bu hökmdədir. Həmçinin hədislərin xeyli bir hissəsi imamlardan sadir olmayıb, bu hədisləri yalançı ravilər uydurublar və onları imamların tələbələrinin kitablarına hiylə edib soxmaqla və ya başqa metodlarla imamlara nisbət ediblər. Təbii ki, bu uydurduqları hədislərə və ya əksərinə səhih isnadlar da uydurublar ki, şiələr tərəfindən qəbul olunsun. Kitablarda yazılmış bu xəbər

---

eyni sualı verdiyini deyirlər, hər dəfə üç ayrı şəxsin gəlib eyni sualı verməsi ehtimalı o qədər aşağıdır ki, bunun bu qədər tez-tez baş verməsi adətən imkansızdır.

[1053] bax: əl-Məclisi, "Bihərul-Ənvar", 11/180; 11/222; 12/113; 14/202; 14/190; 14/215 və 14/401

toplusunun bu iki qrupdan hansına, yəni uydurulmuş və təqiyyə ilə deyilmiş xəbərlərdən hansına aid olduğunu bilmədiyimiz üçün onları mötəbər xəbərlərdən ayıra bilmirik, o zaman isnadı zəiflikdən salamat olan bütün xəbərlər ilə - onların bu iki qrupdan birinə aid olması ehtimalı olduğu halda - necə əməl etmək icazəlidir?!"[1054] əl-Ğureyfi daha sonra rəvayətlərin hamısını tərk etməyin də doğru olmadığını yazır və bu problemi həll etmək üçün iztirablı cavablara qatlanmalı olur. Bu problem bu günə qədər davam etməkdədir. Rəvayətlərdəki bu problem şiə alimlərinin şiddətli şəkildə ixtilaf etməsinə səbəb olub. Şiə alimlərindən Cəfər əş-Şəxuri bizi bəzi misallarla tanış edərək deyir: "Görünür ki, başqalarının yox, məhz şiələrin üzləşdikləri bu halın mənfi təsirləri təqiyyə mərhələsindən sonrakı dövlərdə də izlərini buraxıb, çünki biz rəvayətlərdən hansının təqiyyə ilə deyildiyini, hansının isə həqiqi hökmü bəyan etmək üçün deyildiyini müəyyən etməkdə şiələrin böyük alimlərinin ixtilaf etdiklərini görürük. Buna misal olaraq şərabın nəcis olması məsələsini götür; çox sayda alim - onların arasında ət-Tusi də var - şərabın nəcasətinə fətva verirlər, çünki onlar şərabın təmiz olduğunu deyən rəvayətləri təqiyyə olaraq izah edirlər. Görürük ki, fəqihlər arasında əl-Muqaddəs əl-Ərdəbili və qeyriləri kimi şərabın təmiz olduğuna hökm edənlər də vardır, çünki onlar nəcasət olduğunu deyən rəvayətləri təqiyyə olaraq yozublar. Bu, təqiyyəni istifadə etməkdə keçmiş alimlərin nəzərindəki çıxılmaz vəziyyəti göstərir." Daha sonra bu misal üzərində bir qədər müzakirələr apardıqdan sonra deyir: "Bu misal - *əgər başqa onlarla misallara toxunmaq istəsəydik ayrıca bir kitab yazardıq* - təqiyyə yerlərini müəyyən etməkdə xaosun olduğunu dəstəkləyir, fiqh məsələlərində icma iddialarındakı xaosa bənzəyir və bu, rəvayətlərdən hansının təqiyyə olaraq sadir olduğunu, hansının isə olmadığını müəyyən etməkdəki ixtilafları səbəbi ilə alimlərin öz fətvalarında çoxca ixtilaf etməklərinə gətirib çıxarıb."[1055] əş-Şəxuri'nin bu misalı xüsusiləşdirməsinin səbəbi isə budur ki, şərabın təmiz olmaması sünni məzhəblərinin ittifaq etdikləri bir məsələdir. Buna baxmayaraq imami alimlərinin əksəriyyəti sünnilərə müvafiq olaraq şərabın nəcis olduğuna fətva veriblər və təmiz olduğuna dair gəlmiş rəvayətləri təqiyyə mənasında yozublar. Görəsən kimdən təqiyyə edirdilər?! Şərabın təmiz olduğunu deyən şiə alimlərin başında

---

[1054] əl-Ğureyfi, "Qavaidul-Hədis", 1/160-166; Muəssəsə əs-Seyyidə əl-Məsumə, 1429

[1055] əş-Şəxuri, "Ayətullah əl-Uzma əs-Seyyid Muhəmməd Hüseyn Fədlullah", səh: 72; Darul-Mələk, Beyrut, 1419;

əs-Saduq gəlir.[1056] Burada şərabın təmiz olması haqqında imamlara nisbət edilmiş xəbərləri təqiyyə ilə uyğunlaşdırmaq cəhdləri arasında belə bir izah da yer alır, Muhəmməd Baqir əs-Sadr bunu belə ifadə edir: "Təqiyyənin təsvirində qeyd olunan ikinci izah budur ki, təmizliklə bağlı rəvayətlər, şərab içən və ona toxunmaqdan çəkinməyən hakimlərdən və sultanlardan təqiyyə şəklində olmuşdur." Daha sonra Muhəmməd Baqir əs-Sadr bu rəyə etiraz edərək deyir: "Bu izah o qədər qəribə və sağlam düşüncədən uzaqdır ki, bir fəqihin belə bir şey deyəcəyini gözləməzdim. Birincisi, çünki ictimaiyyətin fikrinə müxalif olanın müvafiq olana tərcih edilməsi ümumi kütlənin dini inanclarını və qanunlarını nəzərə alır, yoxsa onların arasındakı fasiq və günahkarlarının əməllərinə diqqət yetirmir. İkincisi, İmamların - əleyhimussələm - hakimlərin fasiqliyinə bəraət qazandırmaq üçün həqiqətə zidd fətva vermələrini necə təsəvvür etmək olar?! Belə bir hərəkət heç sünni fəqihlərindən olan iffət sahiblərindən sadir olmaz, o zaman necə Əhlul-Beyt imamlarından sadir ola bilər?! İmamların hakimlərə yönəlik işlətdikləri təqiyyə, yalnız onlarla hökmdar kimi davranmaqda və onların hökmdarlığa uyğun olmadıqlarını açıq şəkildə elan etməməkdə özünü göstərirdi, yoxsa onların fasiqliyinə və facirliyinə bəraət qazandırmırdılar. Üçüncüsü, İmam Cəfər Sadiq dövründəki xəlifələrin şərab içdikləri barədə tarixdə heç bir məlumat yoxdur, belə bir şey yalnız sonrakı dövrlərdə bəzi azğın xəlifələrə və ya saxta xəlifələrə aid edilmişdir. Heç bir dövrdə xəlifənin açıq şəkildə şərab içməsi və şərabın nəcisliyinə dair fətva verənləri cəzalandırması səviyyəsinə çatmamışdır. Haram olması üzərində israr edildiyi halda şərab içənlər üçün onun təmiz olduğunu deməyin nə faydası var?!"[1057] Əli Əkbər əl-Məzəndərani bu izahla razılaşmır və yazır: "Aydındır ki, bu izahı o, əl-Vəsail kitabında Şeyxut-Taifə'dən belə deyərək nəql edilmişdir: "Şeyx bu rəvayətləri o dövrün hakimlərindən və sünnilərin bəzi alimlərindən təqiyyə olaraq izah etmişdir.' əş-Şəhid (yəni Muhəmməd Baqir əs-Sadr) bu baxışın qəribəliyinə işarə edərək bildirmişdir ki, sünnilərə müxalif olmaqdan məqsəd onların zalımlarının və fasiqlərinin əməllərinə deyil, fəqihlərinin fətvalarına müxalif olmaqdır. O, həmçinin imamların, zalım hakimlərin fasiqliyinə bəraət qazandırmaq üçün həqiqətə zidd fətva verməkdən uzaq olduğunu iddia etmişdir. Bundan başqa, o, İmam Cəfər Sadiq dövründəki xəlifələrin şərab içdiklərini də inkar etmişdir. Lakin bütün bu arqumentlər

---

[1056] Bax: əl-Kəşəni, "Məfətih əş-Şərai", 1/72;

[1057] "Buhus fi Şərh əl-Urvatil-Vusqa", 3/350;

mübahisəlidir, çünki təqiyyənin əsası özünü qorumaq qorxusudur və bu vəziyyətdə bu qorxu tamamilə mümkün görünür. Üstəlik, şərab içmək zalım hökmdarların və ədalətsiz xəlifələrin adətlərinə yad deyildi və bunu inkar etmək onlar haqqında bildiyimiz adətlərinə ziddir."[1058] Gördüyün kimi, əziz oxucu, bu təqiyyə məsələsi şiə alimlərini çıxılmaz bir vəziyyətə salıb və şərabın halallığına dəlalət edən xəbərləri təqiyyə ilə izah etməyin problemini aradan qaldıra bilmirlər. Bu sadəcə olaraq qarşılaşdığımız çoxsaylı misallardan biridir və şəriətdə bir çox məsələdə təqiyyənin tətbiqində şiə alimləri arasında bu cür ixtilaflara şahid oluruq.

Təqiyyə etiqadının şiələrin mirasında buraxdığı dağıdıcı izi bəlkə də ən yaxşı ifadə edən şiələrin livanlı şeyxlərindən Heydər Hubbullah'dır. O yazır: "İmamilərdə (hədislərin) mətninə kritik yanaşmada təqiyyə nəzəriyyəsinin buraxdığı təsirlərin ölçüsünü kiçiltməyə çalışmaq doğru deyildir; beləki şiələrdən böyük bir çoxluq, əhlul-beyt imamlarının əməvi və abbasi dönəmlərində çətin vəziyyətlərə şahid olduqlarını və bu sıxıntılı vəziyyətlərin onları təqiyyə işlətməyə məcbur etdiyini deyirlər. Lakin bu təqiyyə, imami şiəsinin təsəvvüründə o qədər böyüyüb ki, hətta əhlul-beytin bir çox hallarda doğru olmayan bir metodla, həqiqətə müvafiq olmayan şəkildə yeni hökmlər verdiklərini və ya bu cür dinin əhkamını öyrətdiklərini deyiblər. İddiaya görə bunu öz üzərilərindən ittihamı qaldırmaq üçün və ya özlərini və camaatlarını himayə etmək üçün ediblər.

Bu iddianın mənası budur ki, əhlul-beytdən, onların nəzərində öz zamanlarına uyğun hansısa bir məsləhətə görə reallığa müxalif şeylər - bunların reallığa müxalif olduğunu bildikləri halda - sadir ola bilər. Bu o deməkdir ki, hədisin vaqeyə və ya əqlə müxalif olması özlüyündə ravini yalanlamağa imkan vermir, çünki həmin xəbərin təqiyyə yolu ilə sadir olması mümkündür. Bu hal bizi xəbərin özünü səhih saymağa, lakin eyni zamanda məzmunu ilə əməl etməməyə vadar edir. Bu səbəb xüsusilə imami şiələrdə bəzi hallarda hədisin uydurulduğunu iddia etməyə mane olur, çünki ravi burada hədisi uydurmayıb, əksinə imam onu həqiqətən də deyib, ancaq hədisin məzmununu qəsd etməyib, əksinə bunu təqiyyə ilə deməyə məcbur olub.[1059] Bəlkə də məhz buna

---

[1058] əl-Məzəndərani, "Bədaiul-Buhus fi İlm əl-Usul", 6/354;

[1059] Bu həmçinin o deməkdir ki, şiələrdəki bu təqiyyə nəzəriyyəsi ravilərə imamların adından hədis uydurmaq üçün şərait yaradıb. Ona görə də şiə alimlərindən Muhəmməd Baqir əl-Hakim "Ulumul-Quran" kitabında (səh: 331) etiaf edir ki, "təqiyyə şüarı altında hədis uydurulub və saxtakarlıq edilib."

görə imami şiələr sünnət əhlinin etdiyi kimi "məvduat"[1060] barəsində kitablar yazmayıblar. Hansısa rəvayəti təqiyyə olaraq deyildiyi üçün rədd etməklərinə baxmayaraq onun uydurulduğunu demək onlara çətin gəlir. Üstəlik təqiyyə, imami şiələrdə sadəcə hakimiyyət səbəbi ilə edilən təqiyyə ilə məhdud deyildir, hətta ümumi ictimai rəyə qarşı da təqiyyəni də əhatə edir. Ona görə də imami şiələr onların hədisləri arasındakı ixtilafda raviləri yalanlamağa, hədisləri və sənədlərini zəif çıxarmağa ehtiyac hiss etmir. Çünki onlara görə bu ixtilafın səbəblərinin çoxu hədis uydurmağa dayanmır, əksinə hədisin sadir olma şəraitinə dayanır. İmami şiələrinin əksəriyyətinin seçdiyi bu nəzəriyyənin bəzi nəticələri ilə bağlı mənim şəxsən razılaşmadığım bir mövqeyim var.

Bu məsələ cərh və tədil ilə bağlı olan başqa bir mövzuya da öz təsirini göstərir. Beləki təqiyyə ehtimalını araya soxmaqla hədisi rəvayət edən ravini yalan ittihamından xilas etməyin mənası budur ki, rəvayətlərə baxmaqla,onları etibarları sabit olmuş ravilərin rəvayət etdikləri xəbərlərlə müqayisə etmək yolu ilə və ya onların məzmunlarını, özlüyündə doğruluq dərəcəsini təhlil etməklə o xəbərləri rəvayət etmiş ravilərin saxtakarlıqlarını ifşa etmək heç zaman mümkün olmayacaq. Halbuki sünnət əhlindəki ricəl kitabları ravinin rəvayətlərini bir-bir incələməyin, etibarlı ravilərin rəvayət etdikləri ilə, Kitab və sünnətdəki məlum olan mətnlərlə müqayisə etməyin nəticəsində onun yalan danışdığına hökm edir. Bunun misallarını biz ricəl elmində yazılmış böyük həcmli qaynaqlarda görə bilirik; əl-Mizzi, əl-Hafiz İbn Həcər, əz-Zəhəbi və başqalarının kitabları bunun misallarıdır…

Mənim şəxsi rəyim budur ki, əhlul-beytin dini bəyan etmə məqamında təqiyyəni bu dərəcədə, yəni imami alimlərinin xeyli bir hissəsinin dediyi kimi istifadə etdiklərinə inanmıram. Ağır şəraitlə əhatə olunan bir dəvətçinin dini və onun əhkamını bəyan etmədən susmağı ilə din haqqında doğru olmayan yüzlərlə, bəlkə də minlərlə hədislər danışması arasında fərq vardır."[1061] Sitatın sonu.

Heydər Hubbullah təqiyyə ilə bağlı bu problemi başqa yerdə ələ alarkən yazır: "Bizdən bəziləri bu gün hansısa bir məqamda sıxıntılı və problemli bir fikirlə qarşılaşdıqda "bu, təqiyyə olaraq sadir olub", "bu, təqiyyə və qorxu səbəbi ilə arada itib", "təqiyyə edərək bunun haqqında

---

[1060] "Məvduat" uydurma hədislər barəsində yazılan kitablardır.

[1061] Hubbullah, "əl-Hədis əş-Şərif: Hududul-Mərcəiyyə va Dəvair əl-İhticəc", 1/470-472; əl-İntişar əl-Arabi, Beyrut, 2017

susublar", "bunu təqiyyə olaraq deyiblər", "bunu təqiyyəyə əsasən ediblər" deyirlər və təqiyyəyə dair, bu təqiyyənin bu xəbərdə yox, digər xəbərdə baş verdiyinə dair xüsusi bir dəlil qarşıya qoymurlar. Bu hal, başqalarının imami şiələrinə qarşı işlətdikləri o məşhur sözlərin ən böyük dəlildir: "Bu tayfanın alimlərinə və üzvlərinə heç bir şeydə etimad etmək olmaz, çünki onların etdikləri kələkbazlıq və təqiyyə üzərində qurulub və qarşıya qoyduqları qarmaqarışıq sözlər xaosu içində həqiqi rəylərini bilmək mümkün deyildir." Hətta içimizdən bəziləri bu gün imamları elə təsvir ediblər ki, guya onların - hətta fiqh, ədəb, əxlaq mövzularındakı cüzi bəsit təfsilatlarda belə - minlərlə rəvayətləri təqiyyə ilə sadir olub, halbuki (bu təfsilatların) çoxunda digər müsəlman alimləri şiddətlə ixtilaf ediblər. (Təsvirlərində) o dərəcəyə (çatıblar) ki, onların - aleyhimussələm - dini öyrətməkdə təqdim etdiyimiz təcrübələri guya qapalı, hiyləgar bir üslub olub, onlardan sonra gəlmiş alimlərin, ravilərin, fəqihlərin zehnlərini təşvişə salıb. İçimizdəki bəzi kəslər bu imamları bu cür tanıtdırırlarsa o zaman bunlar necə dini öyrədən kəslər olublar?! Hər dəfə şəxsi qənaətimizə görə problemli hesab etdiyimiz bir nöqtəyə vardığımızda imamın bunu təqiyyə ilə dediyini deyirik ki, bir yerdə isnadı səhih olan hədisdən, başqa yerdə mötəbər bir rəvayətdən - qarşıya heç bir dəlil qoymadan[1062] - canımızı qurtaraq!

Minlərlə hədislərdə onları haqq olmayan sözlər deməklə tanıtmış olmağımız necə bir izahdır?! Bunun fəqət bir neçə səbəbi vardır ki, onlardan biri raviləri (hədis) uydurmaq və saxtalaşdırmaq ittihamından

[1062] Misal üçün Şeyxut-Taifə ət-Tusi "Təhzibul-Əhkəm" və "əl-İstibsar" kitablarında bu cür edir. Rəvayətlərin İmam əl-Baqir və əs-Sadiqdən səhih isnadlarla varid olmaqlarına baxmayaraq onları, sünnilərdəki fiqhə müvafiq olduğu üçün təqiyyə ilə izah edir. Misal üçün aşura orucunun müstəhəb olması, Xeybər ilində siğənin haram edilməsi, xumsun yalnız qənimətlərə aid olması və buna bənzər rəvayətləri təqiyyə deyərək rədd edirlər. əl-Hurr əl-Amili "Vasəiluş-Şiə" kitabında (21/12) deyir: "Məhəmməd ibn əl-Həsən, öz sənədi ilə Məhəmməd ibn Əhməd ibn Yəhya'dan, Əbu Cəfərdən, o da Əbu əl-Cövzə'dən, o da Hüseyn ibn Əlvan'dan, o da Amr ibn Xalid'dən, o isə Zeyd ibn Əli'dən, o öz növbəsində atalarından, onlar da Əlidən - aleyhissələm - belə dediyini rəvayət edir: "Rəsulullah - salləllahu aleyhi va əlihi - Xeybər günü evcil eşşək ətini və müvəqqəti nikahı qadağan etmişdir." Deyirəm: Şeyx və başqaları bu rəvayəti təqiyyə olaraq - yəni rəvayətdə təqiyyə olaraq - izah etmişlər, çünki müvəqqəti nikahın icazəli olması İmamiyyə (şiə) məzhəbinin zəruri məsələlərindən biridir, bu barədə daha əvvəl dəlillər qeyd olunmuşdur və bu məsələni sübut edən dəlillər sonra da gələcəkdir." Bu o deməkdir ki, əslində peyğəmbərimiz - salləllahu aleyhi va səlləm - siğəni qadağan etməyib, sadəcə olaraq Əli və ya onun oğlu Hüseyn və Həsən və ya Hüseynin oğlu Zeynul-Abidin, ya da onun oğlu Zeyd bin Əli təqiyyə edərək yalan bir xəbər rəvayət ediblər ki, sünnilərə müvafiq olsunlar. Belə bir şeyi imamlara nisbət etməyə kimin şərəfi və vicdanı yol verər?!

təmiz çıxarmaqdır! Bir digər səbəb imamların rəvayətlərindən bəzilərini tarixi məzmununda anlaya bilməməkdir. Beləliklə də ravilərdən bəzisini təmizə çıxarmaq məqsədi ilə içimizdən bəziləri - özləri də hiss etmədən - imamları, hər gün fərqli bir söz deyən şəxslərə çeviriblər. Bəzi kəslərin[1063] kitablarında hədisləri ələ almaqlarına baxın və görün necə təqiyyə (prinsipi)ni istifadə etməkdə ifrata varıblar, hətta - özləri də hiss etmədən - əhlul-beyti elə şəxslər olaraq tanıdıblar ki, bu gün onların yanına getsən sənə bir şey deyəcəklər, sabah özün təklikdə yanlarına getsən sənə başqa şey deyəcəklər. Görəsən bu həqiqətən də iddia etdikləri kimi dini öyrətməyin innovativ bir metodudur yoxsa bəzi xəbərləri, raviləri, qənaətləri qorumaqdan ötrü çıxarılmış qapalı və çaşdırıcı bir metoddur?! Üstəlik bir hissəsinin təqiyyə ilə izah olunduğu ziddiyyətli rəvayətlərin ravisi tək bir şəxs ola bilir, Muhəmməd bin Muslim bunun bir misalıdır. Bu, reallıqdan bir misaldır; necə olur ki, İmam ona qarşı bir yerdə təqiyyə edir, başqa yerdə isə etmir?! Bunun tarixi bir izaha ehtiyacı vardır; əgər bu rəvayətlərdən birində Muhəmməd bin Muslim ilə yanaşı imamın hüzurunda başqaları da var idisə nə üçün Muhəmməd bin Muslim özü buna işarə etməyib, halbuki fərz olunana görə o, imamların (dini öyrətməkdə işlətdikləri) bu metodu bizdən daha yaxşı bilməli, onlarla birlikdə bunu yaşamış olmalı deyildimi? Şübhəsiz ki, hansısa tarixi bir həqiqətdən qurtulmaq məqsədi ilə təqiyyə fikrini bu cür ifrat şəkildə işlətmək - bir baxış açısı olaraq - hiylə gəlməkdən başqa bir şey deyildir…"[1064] Həqiqətən də məsələ Şeyx Hubbullah'ın dediyi kimidir. Möminlərin əmiri Əli bin Əbi Talib xəlifə olduğu və siyasi gücü əlində tutduğu dönəmdə icra etdiyi bir çox işlər, atdığı bir çox addımlar imami şiələrinin etiqadı ilə uyğun gəlmir. Misal üçün Əlinin ona qarşı vuruşmuş kəslərlə müsəlman kimi rəftar etməsi, onların əsirlərini öldürməməsi, zürriyyətini kölələşdirməməsi imami məzhəbinin zərurətləri ilə uyğun gəlmir, çünki Əliyə qarşı vuruşmaq küfrdür, sahibini dindən çıxarmalı idi. Bu problemə cavab verməyə çalışan əş-Şərif əl-Murtəda iddia edir ki, "möminlərin əmiri - aleyhissələm - ümməti idarə edərkən öz ixtiyarı ilə əməl etmirdi, öz bildikləri ilə davranmaq imkanına sahib deyildi, əksinə təqiyyə içində

---

[1063] Heydər Hubbullah'ın bəzi kəslər olaraq dedikləri şiələrin ən böyük alimləridir; İbn Bəbəveyh əl-Qummi, Şeyxut-Taifə ət-Tusi, əl-Muhəqqiq əl-Hilli, Mühəddis Yusuf əl-Bəhrani, Mühəddis əl-Əstərabadi, Muhəmməd Baqir əs-Sadr, Əbul-Qasim əl-Xoyi, tələbəsi Muhəmməd Asif Muhsini və başqaları.

[1064] Hubbullah, "İdaət fil-Fikr vad-Din val-İctimə", səh: 84-85; Muəssəsətul-Buhus əl-Muasira, 1436

idi, düşmənləri ilə gözəl davranmağa məcbur idi…”[1065] Həmçinin “Nəhcul-Bələğa” kitabında Əlinin - kərraməllahu vachəhu - xəlifə Ömər haqqında belə dediyi nəql olunur: “Allah fılankəsin[1066] əməyinə görə mükafat versin! O, əyrini düzəltdi və qırığı sağaltdı. Fitnəni arxada qoydu və sünnəti bərqərar etdi. Təmiz bir paltarla və az bir qüsurla ayrıldı. Xeyrini qazandı və şərrindən qaçdı. Allah qarşısında itaətini yerinə yetirdi və Ona haqqı ilə təqva etdi!”[1067] İbn Meysəm əl-Bəhrani bu sözlərin şərhində yazır: “Bil ki, şiələr burada bir sual irəli sürmüşlər və demişlər: “(Əlinin) iki kişidən biri haqqında qeyd etdiyi bu təriflər, onların xətaya düşmələri və xilafət mövqeyini qəsb etmələri ilə bağlı icmamızla ziddiyyət təşkil edir. Ya bu söz həqiqətən onun sözü deyil, ya da bizim icmamız yanlışdır.” Daha sonra isə buna belə izah verir: “Biz qeyd edilən ziddiyyəti qəbul etmirik, çünki ola bilər ki, bu tərifi şeyxlərin (Əbu Bəkr və Ömər) xilafətinin düzgünlüyünə inananların qəlblərini qazanmaq və onları özünə cəlb etmək məqsədilə demişdir.”[1068] Çox qəribə bir hal ilə qarşı-qarşıyayıq. Əgər öz məqamına oturduqdan sonra belə imam, iddia olunan zalımların, fasiqlərin və ya münafiqlərin qorxusundan öz vəzifəsini yerinə yetirməkdən aciz olacaqdısa bunun nə əhəmiyyəti qalır ki?! Əgər imamın öz vəzifələrini yerinə yetirməsi üçün ona tabe olan təbəənin müti olması şərtdirsə elə bir təbəənin zatən imamsız da müti olub məqsədə çatmış olması mümkündür. Bütün bunlardan anlayırıq ki, təqiyyə iddiası sadəcə olaraq məzhəbin ziddiyyətli və çıxılmaz məsələlərində rahatlıq tapmaq üçün uydurulmuş bir fənddir.

Bəlkə də bu adətin nəticəsi olaraq müxaliflər haqqında yalan və böhtan danışmaq, ümumiyyətlə müxalifləri susdurmaq üçün yalandan istifadə etmək fətvalarda rəvac tapıb. Şiələrin böyük fəqihlərindən olan Murtəda əl-Ənsari yazır: “Qeybət bölməsində daha əvvəl bidət əhli haqqında imamın - aleyhissələm - ”onlara böhtan atın ki, sizi azdırmağa könül salmasınlar” sözlərinə gəldikdə isə, bu, bir möminin ittiham edilməsi haram olan şeylərlə onları ittiham etmək və onlar haqqında sui-zəndə olmaq mənası ilə izah olunur; onlar haqqında “ola bilsin ki, zinakardır” və ya “oğrudur” demək bunun misalıdır. Mübaliğə növündən ondan olmayan şeyləri də zikr edərək artırmaq da bunun

[1065] əş-Şərif əl-Murtəda, “Cəvab əl-Məsəil ət-Tarablusiyyə”, səh: 273-274;

[1066] İbn Əbil-Hədid şərhində (12/3) yazır: “Nəhcul-Bələğa kitabını yazmış Əbul-Həsən ər-Radi’nin öz əli ilə yazdığı nüsxəni gördüm və “fılankəs” sözünün altında Ömər yazılıb.”

[1067] ər-Radi, “Nəhcul-Bələğa”, 2/222;

[1068] əl-Bəhrani, “Şərh Nəhc əl-Bələğa”, 4/98;

kimidir. Hədisi zahirinə əsasən məsləhət üçün onlar haqqında yalan danışmağın icazəli olması mənasında da başa düşmək olar, çünki insanları onlardan uzaqlaşdırmağın məsləhəti yalanın fəsadından daha ağırdır."[1069] əl-Ənsarinin "mübaliğə növündən artırmaq" sözündəki mənanı izah edən Muhəmməd əl-Hüseyni əş-Şirazi qeyd edir ki, bir kimsə haqqında "ola bilsin ki, zina edir" demək yerinə mübaliğə edərək "ola bilsin ki, hər gün zina edir" demək də olar. Yəni əl-Ənsari mübaliğə ilə sui-zəndə mübaliğə etməyi qəsd edib.[1070] Mirzə Cavad ət-Təbrizi yazır ki, "birincisinə, yəni bidətçiyə gəldikdə isə onu təhqir etmək, onu alçaltmaq bir kənarda qalsın, ona böhtan atmaq da icazəlidir."[1071] Muhəmməd Rza əl-Kulbeykəni isə yazır: "Bidətçiyə gəldikdə isə onun barədə pis danışmaq icazəlidir, çünki o, hörmətsizliyə layiqdir. Davud ibn Sirhandan İmam Əbu Abdullah - aleyhissəlam - vasitəsilə nəql olunan bir rəvayətdə Allahın Rəsulu - salləllahu aleyhi va əlihi - belə buyurmuşdur: "Məndən sonra şübhə əhli və bidət əhlini gördükdə onlardan uzaq olduğunuzu açıqca bəyan edin, onları tez-tez pisləyin, onlar haqqında danışın, onları təhqir edin və onlara yalan sözlər nisbət edin ki, İslamda fitnə-fəsad yaymağı arzulamasınlar. İnsanlar onlardan ehtiyat etsin və onların bidətlərindən dərs almasınlar. Allah bu əməlləriniz üçün sizə savablar yazar və axirətdə dərəcələrinizi yüksəldər." Bu rəvayətin məzmununa əsasən, bidətçilərə yalan və iftira nisbət etmək icazəlidir. Lakin yalan danışmaq ümumiyyətlə haram olduğuna görə, burada daha böyük bir məsləhət üçün yalana icazə verilmiş olması labüddür: və bu məsləhət bidətçinin hörmətini azaltmaq və insanların gözündə onun statusunu sındırmaqdır ki, ona meyillənib onun vasitəsilə yoldan çıxmasınlar. Əks təqdirdə, yalan və iftira icazəli deyil."[1072] Muhəmməd Sadiq ər-Ruhani yazır: "İmamın - aleyhissəlam - "*Onları çoxca söyün*" ifadəsinin qeydsiz-şərtsiz təfsiri - açıq şəkildə ifadə edilməsə də - və onun "*onlara böhtan atın*" ifadəsinin aydın mənası, onların təkcə aşkarda bilinən bidətləri üçün deyil, həm də onlarda olmayan şeylər üçün də söyülməklərinin icazəli olduğunu göstərir."[1073] Həmçinin Əbul-Qasim əl-Xoyi deyir: "Müxaliflər və ya bidət əhli haqqında pis danışmağa gəlincə, bunun icazəli olduğuna heç bir şübhə yoxdur. Artıq *qeybət* haqqında müzakirədə qeyd olundu ki,

---

[1069] əl-Ənsari, "əl-Məkasib", 2/118;

[1070] əş-Şirazi, "İysalut-Talib iləl-Məkasib", 4/52-53;

[1071] ət-Təbrizi, "Ususul-Hudud vat-Təzirat", səh: 235;

[1072] əl-Kulbeykəni, "Durrul-Məndud", 2/148;

[1073] ər-Ruhani, "Minhəcul-Fəqahə", 1/379;

'mömin' termini yalnız On İki İmamın - aleyhimussələm - rəhbərliyini qəbul edən və onların itaətinin vacibliyini tanıyan şəxslərə aiddir. Aydındır ki, təhqir etməyin haramlığı ilə bağlı olan dəlillər yalnız şiə möminlərə şamil edilir, buna görə də başqaları təhqirin haramlığı çərçivəsindən kənarda qalır… Bəs dində bidət edənləri və ya müxalifləri onlarda olmayan qüsurlarla təhqir etmək icazəlidirmi, yoxsa onların həqiqi qüsurlarını qeyd etməklə məhdudlaşmaq lazımdır? Yalan sözlərlə onlarda olmayan qüsurları zikr etməklə onları təhqir etmək Qur'an və Sünnəyə əsasən haramdır, bu da yalanın haramlığı haqqında müzakirədə izah edilmişdir. Lakin bəzi hallarda güclü bir məsləhət, onlara böhtan atmağı, onları aşağılamanı və onlara onlarda olmayan şeyləri aid etməyi tələb edə bilər. Bunun məqsədi zəif möminlər üçün onların işlərini aşkara çıxarmaq, onların pis fikirlərinə və yanıltıcı məqsədlərinə aldanmamalarını təmin etməkdir. Bu, İmamın - aleyhissələm - bu ifadəsi ilə izah edilir: "Onlara böhtan atın ki, İslamda fitnə çıxarmağı arzulamasınlar." Bütün bunlar yalnız təhqirin heç bir zərər və ya fitnə ilə nəticələnmədiyi hallara aiddir; əks halda, hətta onların həqiqi qüsurlarını qeyd etmək də haram olar. Yuxarıda izah edilənlərdən aydın olur ki, müxalifləri təhqir etmək bəzən mübah, bəzən müstəhəb, bəzən vacib, bəzən məkruh, bəzən isə haram ola bilər. Bu sonuncu hökmə, İmamın - aleyhissələm - Əbu Həmzənin rəvayətində müxaliflərə zina ittihamı barədə dediyi bu ifadədə əks olunur: "Bundan çəkinmək daha gözəldir."[1074] Əbul-Qasim əl-Xoyi'nin sözünü etdiyi sonuncu hədisi əl-Kuleyni "əl-Kəfi" kitabında rəvayət edir: "Əbu Həmzə İmam Əbu Cəfərdən - aleyhissələm - nəql edir: "Ona dedim: "Bəzi dostlarımız onlara müxalif olanlara iftira atırlar və onları qəzf edirlər." O mənə dedi: "Bundan çəkinmək daha gözəldir." Sonra dedi: "And olsun Allaha, ey Əbu Həmzə, bütün insanlar zinakarların övladlarıdır, yalnız bizim şiələrimiz istisnadır."[1075] əl-Məclisi hədisin zəif olduğunu dedikdən sonra izahında buyurur: "Onun "*iftira atırlar*" sözləri o deməkdir ki, başqalarını zinada ittiham edirlər. İmam - aleyhissələm - cavab verdi ki, onların *təqiyyə*ni tərk etmələri doğru deyil, lakin onların sözlərinin doğru bir mənası vardır."[1076] Muhəmmət Təqi əl-İrəvani "əl-Hadəiq ən-Nədira" kitabında Yusuf əl-Bəhrani'nin belə dediyini nəql edir: "Deyirəm: Müxaliflərin qeybətinin icazəli olması ilə bağlı ən açıq dəlillərdən biri də İmamların -

---

[1074] əl-Xoyi, "Misbəhul-Fəqahə", 1/700-701;

[1075] əl-Kuleyni, "əl-Kəfi", 8/285;

[1076] əl=Məclisi, "Mirətul-Uqul", 26/206;

aleyhissələm - onları zinakarların övladları olmaqla ittiham etmələridir. Bu dəlillərdən biri də *əl-Kafi* kitabında Əbu Həmzədən nəql edilən rəvayətdir. Əbu Həmzə belə deyir: "Mən Əbu Cəfərə - aleyhissələm - dedim: "Bəzi dostlarımız onlara müxalif olanlara iftira atır və qəzf edirlər." O cavab verdi: "Bundan çəkinmək daha gözəldir." Sonra dedi: "And olsun Allaha, ey Əbu Həmzə, bütün insanlar zinakarların övladlarıdır, yalnız bizim şiələrimiz istisnadır." Sonra əlavə etdi: "Biz *xums* və *fəy'in* sahibləriyik və onu bütün insanlara haram etmişik, yalnız bizim şiələrimiz istisnadır." Buna bənzər bir rəvayət "ət-Təhzib" kitabında Durays əl-Kinani tərəfindən nəql olunur. İmam Əbu Abdullah (ə) belə buyurdu: "Sən bilirsənmi, zina insanların arasına haradan gəldi?" Dedim: "Bilmirəm." Buyurdu: "Bu, bizim Əhli-Beytin *xums* payının haqsız yerə mənimsənilməsi səbəbindən olmuşdur, lakin bizim pak şiələrimiz üçün bu (*xums*) halal edilmişdir ki, onların doğumu halal olsun." Bu mövzuda *xums* haqqında çoxlu sayda rəvayətlər vardır. Əgər İmamlar - aleyhimussələm - müxalifləri belə ittiham etmiş və onları dini baxımdan ən ağır *qeybət* növü ilə pisləmişlərsə, necə *qeybət* etməyin haram olduğunu iddia etmək olar?! Xülasə, deyilənlər inkar edilə bilməyəcək qədər aydındır. Buna əsasən, birinci rəvayətdəki *"Bundan çəkinmək daha gözəldir"* ifadəsi *təqiyyə* halının qorunulması kimi başa düşülür, çünki bu sözdən sonra bəzi dostlarımızın nəql etdiyi məlumat təsdiqlənmişdir. Bu, Allahın lütfü ilə, açıq-aydındır."[1077]

## Həqiqi imamlar yoxsa?

Ağır təəssüf hissi ilə deməliyik ki, peyğəmbərin - aleyhissalətu vassələm - əhlu beytini ən pis surətdə göstərən, onlara ən utancverici xüsusiyyətlər nisbət edənlər özlərini əhlul-beytin fanatları adlandıran şəxslərdir. Bəlkə də bunu düşünmədən, dərk etmədən edirlər, lakin nəticə etibarı ilə bu mübarək şəxslərə nisbət edilən əməllər, məqsədlər və ya xüsusiyyətlər onlara yaraşdırılması mümkün olmayan yalanlardır. Bəzən bunu hansısa səhabəni qaralamaq üçün edirlər; misal üçün Öməri gözdən salmaq üçün onun Fatimə ilə Əli'nin evinə basqın etdiyini, Fatiməni qapının arasında

[1077] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira", 18/155;

qoyub sıxdığını, qabırğalarını sındırdığını, uşağını düşürdüyünü yazırlar. Bütün bunları edərkən də igid və qorxmaz Əlinin evin içərisində oturub buna səbr etdiyini deyirlər. Əlini tanıyan insan çox gözəl bilir ki, o, peyğəmbərin - aleyhissalətu vassələm - qızına qarşı edilən zülmə susmazdı, əksinə bu hərəkətin qarşısında cihad edərək batil əhlinin cəzasını verərdi, ən azından qalxaraq öz sinəsini qarşıya verər və özünün zərər görməsinə razı olub peyğəmbər qızını qoruyardı. Üstəlik evin kişisi evdə olduğu halda naməhrəm kişilərə qapını açmaq üçün nə üçün peyğəmbərin mübarək qızı qalxmalı idi?! Görünür ki, səhabələrə qarşı körüklənən nifrət, onları qaralamaq sevdası aydın düşünməyə imkan verməyib və bu cür yalanların uydurulmasına şərait yaradıb.

Əhlul-beytin imamlarına nisbət edilən bu təqiyyə adəti də bu cür iftiralardan biridir və əslində bu iddia olunanlar heç bir şəkildə haqq əhlinə, mücahidlərə yaraşdırıla bilməz. Biz inanırıq ki, əhlu beyt imamları öz şəxsi təhlükəsizlikləri xatirinə müsəlmanlara batil dini öyrətməyə heç zaman razı olmazlar. Halbuki şiələrin alimləri bu imamlara məhz belə bir şeyi nisbət edirlər; yəni ki, guya Muhəmməd əl-Baqir, Cəfər əs-Sadiq, Musa əl-Kazım kimi böyük imamlar müsəlmanlara üzdə yalan danışıblar, onların suallarına bilərəkdən doğru olmayan batil cavablar veriblər. Misal üçün Əbən bin Təğləb deyir: "Əbu Abdilləhi - aleyhissələm - belə deyərkən eşitdim: "Atam - aleyhissələm - əməvilərin zamanında qırğı və qızılquşların ovladıqlarının halal olduğuna fətva verərdi, onlardan təqiyyə edərdi. Mən onlardan təqiyyə etmirəm və (deyirəm ki, şikarını) öldürdüyü müddətdə haramdır."[1078] Bir başqa yerdə əl-Hələbi deyir: "Əbu Abdilləh - aleyhissələm - dedi: "Atam qorxu içində olduğumuz zaman qırğıların və qızılquşların ovladıqları haqqında fətva verərdi və təqiyyə edərdi. İndi isə qorxmuruq və bu quşların ovlarını - diri ikən yetişib kəsmək halı müstəsna olmaqla - halal saymırıq…"[1079] Belə çıxır ki, Muhəmməd əl-Baqir müsəlmanlara bu cür fətva verərkən qorxduğu üçün təqiyyə edərək batil olan şeyləri öyrədərdi. Haram olduğuna inandığı bir şeyi müsəlmanlara halal deyərək öyrədərdi, yəni müsəlmanlara və onların balalarına haram ət yedirərdi. Daha əvvəl də qeyd etdiyimiz bir rəvayətdə Zurara imam əl-Baqirə sual verdiyini deyir və ondan bir cavab aldığını qeyd edir: "Sonra onun yanına başqa bir nəfər gəldi və eyni məsələni soruşdu, ona isə mənə verdiyi cavabdan fərqli bir cavab

---

[1078] əl-Kuleyni, "əl-Kəfi", 6/208;

[1079] əl-Kuleyni, "əl-Kəfi", 6/207; əl-Məclisi "Mirətul-Uqul" kitabında (21/342) isnadının səhih olduğunu yazır.

verdi. Sonra bir başqa nəfər gəldikdə ona da mənə və ikinci adama verdiyi cavabdan tamamilə fərqli bir cavab verdi. Sonra hər iki adam onun yanından çıxıb getdikdə soruşdum: "Ey Peyğəmbər övladı, İraq əhlindən olan o iki nəfər sizin şiələrinizdəndir, gəlib sizə sual verdilər, onların hər birinə niyə fərqli cavablar verdiniz?" Dedi: "Ey Zurara, bu, bizim üçün daha xeyirli və sizin üçün daha salamat olandır. Əgər bir rəy üzərində icma etsəniz insanlar sizin bizim haqqımızda dediklərinizi doğrulamış olardılar, o zaman bu, bizim və sizin əmin-amanlığımız üçün daha təhlükəli olardı." Zurara daha sonra bu olanları imam Cəfərə ərz etdiyini və ona belə dediyini söyləyir: "Siz şiələrinizi nizələrə qarşı və ya atəşə qarşı göndərsəniz hamısı (bir bütöv olaraq) sinə gələrlər, amma sizin yanınızdan çıxdıqlarında ixtilaf etmiş olaraq çıxırlar." (Zurara) dedi: "O mənə atasının verdiyi cavabın eynisini verdi."[1080] Bu rəvayətdən açıq şəkildə anlaşılır ki, imamlar nəinki sünnilərə doğru olmayan biliklər öyrədiblər, hətta öz şiələrinə bir-birindən fərqli və batil fikirlər təbliğ ediblər. Bununla da şiələrin ixtilafa düşməsini, fərqli fikirlər üzərindən parçalanmasını istəyiblər və iddiaya görə bunu etməklə şiələri düşmənlərinin gözündə kiçiltməyi, beləliklə də onları düşmənlərin potensial zülmündən qorumağı məqsəd güdüblər. Necə düşünmək olar ki, imamlar qəsdən insanlara yalan danışıblar, onlara doğru olmayan cavablar veriblər. Məgər onların vəzifəsi insanlara haqq dini öyrətmək deyildimi?! Şiələr məgər demirlərmi ki, insanları hidayətə yaxınlaşdırmaq, onlar üçün doğru olanı seçməyi asanlaşdırmaq lütfdür və bu lütf Allahın üzərinə vacibdir?! O zaman necə olur ki, Allah, insanlara batil olan ilə fətva verən, onlara yalan danışmağa məcbur olan imamlar göndərərək insanları azdırır?! Bunun harası lütfdür?!

Üstəlik onların zamanında yalnız onlara qarşı siyasi təzyiqlərin olduğunu, yalnız onların təqib olunduqlarını demək doğru deyildir. Əksinə o dövrdə zalım xəlifələr, vəzirlər, valilər sünnət əhlinin imam olaraq qəbul etdikləri alimlərə qarşı da zülm ediblər. Lakin sünnilərin alimləri və fəqihləri - məsum olmadıqları halda - yenə də bu zülmə qarşı direniblər, amma insanları dinlərində azdıracaq şəkildə yalan fətva verməyiblər. Bunu nümayiş etdirmək üçün Əbu Hənifə'nin misalı ilə başlaya bilərik; o, ən kritik vəziyyətlərdə haqq bildiyi işi müdafiə etməkdən çəkinməzdi. Hətta əhlul-beyt nümayəndəsi olan ən-Nəfs əz-Zəkiyyə'nin hicri 145-ci ildə başlatdığı üsyana dəstək vermişdi, onun

[1080] əl-Kuleyni, "əl-Kəfi", 1/65; əl-Məclisi kitabında (1/217) "muvassəq kəs-sahih" olduğunu deyir.

üçün dörd min dirhəm göndərmişdi. Ömrünün sonunda xəlifə Əbu Cəfər əl-Mənsur ona Bağdadda qazi olmağı təklif edir, lakin Əbu Hənifə bundan imtina edir. Bu itaətsizliyi cəzalandırmaq üçün xəlifə onu Kufədən Bağdada gətirir, orada həbs edir, bəzi rəvayətlərə görə şallaqlanır. Məşhur olan budur ki, Əbu Hənifə yetmiş yaşında həbsdə ikən vəfat edir.[1081] Həmçinin sünnət əhlinin digər imamı Malik bin Ənəs'in verdiyi fətva hakimiyyət dairələrini qəzəbləndirmişdi. Bu zaman Mədinə şəhərinin valisi xəlifə əl-Mənsurun əmisi oğlu Cəfər bin Süleyman idi. Ona belə bir xəbər çatdırırlar ki, Mədinə şəhərinin imamı Malik bin Ənəs "sizə verilmiş beyətləri bir şey hesab etmir, çünki "məcbur olunanın boşaması keçərli deyildir" hədisini rəvayət edir. Cəfər bin Süleyman bu deyilənləri yoxlamaq üçün onun məclisinə adam göndərir. ət-Təbəri hadisə barədə danışarkən rəvayət edir ki, Muhəmməd ibn Abdullah bin əl-Həsən'ə qoşulub dövlətə qarşı çıxmaq haqqında Malik bin Ənəs'dən fətva soruşdular və ona dedilər ki, "boyunlarımızda Əbu Cəfərə etdiyimiz beyət hələ də qalır." Malik deyir: "Siz məcbur edilərək beyət etmisiz və (hədisdə gəldiyi kimi) məcbur edilənin üzərinə yəmin yoxdur." Bu cavabdan sonra insanların bir çoxu Muhəmməd ən-Nəfs əz-Zəkiyyə'yə qoşulurlar və Malik öz evinə qapanır.[1082] Bundan sonra Maliki həbs edirlər, onu şallaqlayırlar və döyürlər, qolları dartıldığı üçün çiyinlərindən çıxır. Onun cəzasını Mədinə xalqına nümunə etmək üçün başını qırxırlar və dəvənin üzərinə oturdub döyülmüş halı ilə şəhərin küçələri ilə gəzdirirlər ki, insanlar onu tanısınlar və ibrət olsun. İbn Vəhb deyir ki, bu zaman dəvənin üstündə ikən ona özünü insanlara tanıtmasını əmr edirlər və Malik deyir: "Bura baxın! Məni tanıyan artıq kim olduğumu bilir, məni tanımayanlar isə bilsinlər ki, mən Əsbahi qolundan Əbu Amir'in oğlu Ənəs'in oğlu Malikəm və mən deyirəm ki, "məcbur edilmiş birinin boşaması bir şey sayılmır." Bunun xəbəri şəhərin əmirinə çatdırılır və o deyir: "Dərhal ona çatın və dəvənin üstündən endirin!"[1083] Rəvayət olunana görə Malik o qədər ağır döyülmüşdü ki, qollarını işlədə bilmirdi, əynindəki paltarını düzəldə bilmirdi. Bununla belə insanların qarşısında haqqı söyləməkdən geri addım atmadı. Halbuki təqiyyə edərək bu əziyyətlərdən qurtula bilərdi, amma insanlara yalandan fətva verməmək üçün, batil təlimlər öyrətməmək üçün bu zülmlərə

---

[1081] Əbu Nueym, "Musnəd əl-İmam Əbi Hənifə", səh: 18; Məktəbətul-Kəvsər, Riyad, 1994

[1082] ət-Təbəri, "Tarix ət-Təbəri", 5/170; Darul-Fikr; əz-Zəhəbi "Siyər Əaləm ən-Nubələ", 8/79-81; Muəssəsətur-Risələ;

[1083] Əbu Nueym, "Hilyətul-Əvliyə", 6/316; Dar əl-Kutub əl-İlmiyyə, Beyrut, 1988

qatlanmağa razı olur. Həqiqətən də bu fədakarlığın nəticəsində İmam Malik'in şanı kiçilmir, əksinə daha da ucalır və bu gün onun məzhəbi böyük bir coğrafiyada hələ də yaşamaqdadır.

Daha bir misal hənbəli məzhəbinin imamı Əhməd bin Hənbəldir. Onun zamanında abbasilərin üç xəlifəsi, Əbul-Abbas əl-Məmun (h. 218), Əbu İshaq əl-Mutəsim (h. 227) və Əbu Cəfər əl-Vasiq Billəh (h. 232) insanlara "Quran məxluqdur" etiqadını məcburi qəbul etdirmək üçün dövlət zorakılığından tam bir formada istifadə edirdilər. Bu yolda sünnət əhlinin alimlərindən bir çoxu öldürüldü, həbs olundu, döyüldü. Bu əziyyətlərə məruz qalanların başında Əhməd bin Hənbəl gəlirdi. O, xəlifə əl-Məmun və əl-Mutəsim zamanında Bağdadda üç ilə yaxın bir müddət həbsdə qaldı. Bu müddətdə dəfələrlə onu mənəvi olaraq sındırmaq üçün münazirə məclislərinə çıxarıldı, lakin Əhməd öz sözündən dönmədi. Əbul-Arab əl-İfriqi isnadı ilə Əhmədin özünün belə xatırladığını rəvayət edir: "Biz onun, yəni Əbu İshaq əl-Mutəsim'in hüzurunda ikən mənimlə münazirə etdilər və ayaqlarımda üç qandal var idi, mənə ağırlıq edirdi. Mənimlə münazirə etmək üçün əlliyə yaxın nəfər toplamışdılar. Dedim: "Mən sizinlə yalnız Allahın kitabında və ya elçisinin sünnətində olanla danışacam." Onları susdurdum, buna görə Uceyf (bin Uneysə) məni qılıncının dəstəyi ilə vuraraq dedi: "Sən tək başına bu böyüklükdə kütləyə qalib gəlmək istəyirsən?" İshaq bin İbrahim də məni qılıncının dəstəyi ilə vurdu - Əbu Abdilləh Əhməd bin Hənbəl (bunu deyərkən) əli ilə boğazını göstərdi - və dedi: "Sənmi "yalnız Allahın kitabı və peyğəmbərinin sünnəti" deyirsən?!" Əbu İshaq əl-Mutəsim ona dedi: "Onu götürün!" Əhməd deyir: "Məni biləyimdən tutdular və dartdılar, hətta bu günə qədər onun ağrısını çiynimdə hiss edirəm. İki cəllad idi; hər biri şallaq ilə zərbə endirib kənara çəkilirdi, o vaxt otuz zərbə ilə döyüldüm."[1084] Xəlifə əl-Vasiq Billəhin zamanında isə Əhmədə dərs verməyi, məscidlərə, camaat namazlarına, cümələrə çıxmağı qadağan etmişdilər. Evini gəlib təftiş edir və əziyyət verirdilər.[1085] Bütün bu işgəncələrə, həbslərə, əziyyətlərə, ölüm təhdidlərinə baxmayaraq Əhməd bin Hənbəl təqiyyə etmədi, haqqı söyləməkdən çəkinmədi və bu gün onun məzhəbi hələ də yaşamaqdadır, sünnət əhlinin dilində Əhməd əhlüs-sünnətin imamı kimi qəbul və etiraf görür.

---

[1084] Əbul-Arab, "əl-Mihən", səh: 452; Darul-Ulum, Riyad, 1984

[1085] Saleh, "Siratu əl-İmam Əhməd bin Hənbəl", səh: 94; Darud-Davə, İskəndəriyyə, 1404

Əhməd bin Hənbəlin bu sınaqlar qarşısında sabit qalması, ikrah altında rüxsətdən istifadə etməməsinin səbəbi var idi. Əhməd özü xatırlayır və deyir: "Mən yaşının kiçikliyinə, elminin azlığına baxmayaraq Muhəmməd bin Nuh kimi Allahın buyuruqlarını yerinə yetirən başqa birini görmədim və ümid edirəm ki, Allah onun sonluğunu xeyirli etdi. Bir gün onunla başbaşa ikən mənə dedi: "Ey Əbu Abdilləh, Allahı sənə and verirəm, sən mənimlə eyni deyilsən, insanlar sənin dediklərinə tabe olurlar. Bu insan kütləsi sənin nə deyəcəyini gözləyir, ona görə də Allahdan qorx və Allahın əmrində sabitqədəm dur!" Onun mənə dəstək verməsi, mənə öyüd-nəsihət etməsi xoşuma gəldi." Əhməd ilə Muhəmməd bin Nuh arasındakı bu dialoq hər ikisi əlləri-qolları qandallı ikən Bağdad şəhərindən Tarsus şəhərinə göndərilərkən olub, Raqqa şəhərində olan xəlifə əl-Məmun onların hər ikisinin həbs edilməsini əmr etmişdi. Gəmiyə mindirilib Fərat çayı ilə gətirilərkən Muhəmməd yolda xəstələnir və vəfat edir. İmam Əhməd İraqdakı Anə şəhərində onun cənazəsini qılır və dəfn edir.[1086] Tələbəsi əl-Mərruzi rəvayət edir ki, İmam Əhmədi iki hunbəz arasında bağlı ikən ziyarət edir və deyir: "Ey ustad, Allahu - təalə - deyir ki, "özünüzü öldürməyin!" Əhməd dedi: "Ey Mərruzi, çıx çölə və bax nə görürsən?" Dedi: "Xəlifə sarayının bağına çıxdım və orada saya bilmədiyim qədər insan var idi, əllərində də kağız, qələm və mürəkkəb tutub durmuşdular." əl-Mərruzi onlardan soruşur: "Burda nə edirsiz?" Dedilər: "Əhmədi gözləyirik ki, (dediklərini) yazaq." əl-Mərruzi dedi: "Öz yerlərinizə gedin!" Sonra Əhməd bin Hənbəlin yanına daxil oldu, əvvəlki yerində durmuşdu və dedi: "Sənin nə deyəcəyini gözləyən və dediklərini yazmaq üçün əlində qələm və kağız tutan bir qrup gördüm." Dedi: "Ey Mərruzi, səncə bunların hamısını azdırımmı? Özümü öldürərəm, lakin bunları azdırmaram."[1087] Əmisi İshaq bin Hənbəl onu həbsdə ikən ziyarət etdiyində deyir: "Ey Əbə Abdilləh, sənin dostların (Quran məxluqdur tələbinə) cavab verdilər, sənin Allah ilə aranda üzrün var. Sənin dostların və camaat istədiklərini elədilər, sən isə həbsdə və sıxıntı içində qalmısan." Dedi: "Ay əmi, əgər alim təqiyyə edib (onların istədiklərinə) tabe olsa və cahil cahilliyindən (onların istədiklərini) desə onda haqq nə zaman ortaya çıxacaq?! Əmisi deyir: "Bu cavabın qarşısında susdum."[1088] Bu sınaq dönəmində həbs olunan və həbsdə

---

[1086] əl-Xatib, "Tarixu Bağdad", 4/517; Darul-Ğarb əl-İsləmi, Beyrut, 2002; İbnul-Cəvzi, "Mənaqib əl-İməm Əhməd", səh: 425-426; Dar Həcər, 1409

[1087] İbnul-Cəvzi, "Mənaqib əl-İməm Əhməd", səh: 446; Dar Həcər, 1409; əl-Maqdisi, "Mihnətu əl-İməm Əhməd bin Hənbəl", səh: 152-153; Dar Həcər, 1987;

[1088] Hənbəl bin İshaq, "Kitəbul-Mihnə", səh: 95-96; Mərkəz əl-Məlik Feysal, 2019

ölənlər arasında İmam əş-Şafinin tələbəsi Əbu Yaqub əl-Buveyti də var idi. Bağdadda Əhməd bin Nasr əl-Xuzai "Quran məxluqdur" sözünü deməkdən imtina etdiyi üçün edam edilmişdi. İbn Teymiyyə də haqq bildiyi rəyi müdafiə etmək uğrunda dəfələrlə həbs edilmiş, işgəncə görmüşdü. Buna baxmayaraq insanlara doğru olanı öyrətməkdən geri addım atmamış, Allahın dinini öz həyatından önə keçirmişdir. Bunun misalları tarixdə məşhurdur və biz yazımızı bu misalları bir-bir qeyd edərək uzatmaq istəmirik. Göstərdiyimiz bu misalların hamısı əhlüs-sünnətin öz böyük alimləri haqqında bilib fəxrlə danışdıqları misallardır və sünnət əhli öz alimlərini bu şəkildə görmək və göstərmək istəyirlər. Bunun qarşılığında isə misal üçün şiələrin on ikinci imamının nə üçün qeybətə çəkildiyini izah etməyə çalışan Şeyxut-Taifə ət-Tusi deyir: "Onu gizlənməyə möhtac etdilər, çünki öz canı üçün qorxurdu..."[1089] Bəli, doğru oxudunuz. Sünnət əhlinin imamları Allahın dinini qorumaq üçün güzəşt etmədən zalıma sinə gəldikləri halda on ikinci imam öz canını qorumaq üçün meydanı zalımlara tərk edib. Bu necə də İmam əl-Hüseyn'in həyat hekayəsindən uzaqdır?!

Bəs görəsən Muhəmməd əl-Baqir və Cəfər əs-Sadiq həyatı boyunca yuxarıda adlarını çəkdiyimiz alimlərin üzləşdikləri müsibətlərlə qarşılaşmışdılarmı? Maraqlı olan budur ki, şiə alimlərinin özləri belə imamların eyni dərəcədə zülm ilə qarşılaşdıqlarını yazmırlar. Tarixdən bizə məlum olan budur ki, əməvi hakimiyyətinin sonlarında və ilk abbasi xəlifəsi əs-Səffəh'in zamanında onlara qarşı heç bir təqib olmayıb, lakin bəzi təzyiqlər ilə qısa bir müddət ərzində xəlifə Əbu Cəfər əl-Mənsur'un zamanında üzləşilib. Şiələr beşinci imam Muhəmməd əl-Baqir'in öz zamanında əl-Həsən əl-Basri, Qatədə bin Diəmə, Əbu Amr bin Ubeyd, Tavus bin Keysən əl-Yəməni kimi zamanının məşhur alimləri ilə açıq münazirələrdə iştirak etdiyini, hətta Məkkədə ikən əməvi xəlifəsi Hişəm bin Abdilməlik ilə münazirəsinin olduğunu deyirlər.[1090] Bütün bunların işığında necə demək olar ki, Muhəmməd əl-Baqir qorxu içində yaşayırdı və təqiyyə edərdi?! ət-Tusi "Təhzibul-Əhkam" kitabında rəvayət edir ki, Əbu Basir deyib: "Əbu Abdilləhə soruşdum: "Fəcrin iki rükətini nə zaman qılım?" Mənə dedi: "Fəcrin vaxtı girdikdən sonra." Ona dedi: "Əbu Cəfər mənə o iki rükəti fəcr girmədən əvvəl qılmağı əmr etdi." (Cəfər əs-Sadiq) cavab verdi:

---

[1089] ət-Tusi, "Təmhidul-Usul", səh: 507 (Muəssəsə əl-İmam əs-Sadiq çapı; 1983-cü ilin çapında isə səh: 349)

[1090] ət-Tabərsi, "əl-İhticac", 2/64-66;

“Ey Əbu Muhəmməd[1091], şiələr onun yanına irşad axtararaq gəldikləri üçün onlara acı haqq ilə fətva verərdi. Mənim yanıma şəkk edərək gəldilər, mən də təqiyyə ilə fətva verdim.”[1092] əl-Kuleyni “əl-Kafi” kitabında rəvayət edir ki, Əbu Bəsir deyib: “Əbu Abdilləh’dən qunut barəsində soruşdum: “Dedi: “Ucadan səslə oxunan namazlarda.” Dedim: “Mən atandan bu haqda soruşdum. Dedi: “Beş namazın hamısında.” (Cəfər əs-Sadiq) dedi: “Allah atama rəhmət etsin! Atamın tələbələri onun yanına gəlib soruşdular, o da onlara haqq ilə fətva verdi, sonra mənim yanıma şəkk edərək gəldilər, ona görə də mən onlara təqiyyə ilə cavab verdim.”[1093] Buradan anlaşılan budur ki, Muhəmməd əl-Baqir təqiyyə etməzdi, amma oğlu İmam Cəfər isə təqiyyə edərdi.[1094] Əhlüs-sünnət imamlarının zülm və işgəncə qarşısında göstərdiyi mətanət ilə fəxr edən sünnət əhlinə şiə qardaşlarımız öz imamlarını necə təqdim edirlər? On ikinci imamın insanlardan gizlənməyini nə ilə izah edirlər? Şeyxut-Taifə ət-Tusi yazır: “Onun (İmamın) ortaya çıxmasına mane olan yeganə səbəb, öz canının təhlükədə olması və öldürülməkdən çəkinməsidir. Əgər səbəb bundan başqa bir şey olsaydı, gizlənməsi icazəli olmaz və o, hər növ əziyyət və məşəqqətə dözərdi. Çünki imamların və eləcə də peyğəmbərlərin – aleyhimussəlam – məqamları, Allah yolunda çəkdikləri böyük əziyyətlər və məşəqqətlər səbəbilə ucalmışdır.”[1095]

Müasir üsulilərin şeyxi əl-Vahid əl-Bəhbəhani də Əbu Bəsir’in rəvayətlərində keçənləri təsdiqləyərək yazır: “əl-Baqir’in təqiyyə etmədiyini biz başqa dəlillərdən də bilirik. Bunlardan biri budur ki, əməvilər və abbasilər öz aralarında müharibə etməklə məşğul idilər, əs-Sadiq’in zamanının əvvəlləri də belə idi, lakin axırlarında abbasi dövləti müharibəni qurtarmışdı və (xəlifə) əl-Mənsur’un zamanında təqiyyə

---

[1091] Əbu Bəsir’in həqiqi kunyəsi Əbu Muhəmməd olub.

[1092] ət-Tusi, “Təhzibul-Əhkəm”, 2/135;

[1093] əl-Kuleyni, “əl-Kəfi”, 3/339; əl-Məclisi “Mirətul-Uqul” kitabında (15/166) “muvassəq və ya həsən” hökmü verir.

[1094] Bu çox maraqlı bir rəvayətdir, çünki burada sual verən Əbu Bəsir Yəhya bin Əbil-Qasim əl-Kufi əl-Əsədi imami şiələrində “əshabul-icmə” olaraq tanınan ravilərdəndir. Lakin buna baxmayaraq Cəfər əs-Sadiq guya ona qarşı da təqiyyə edir, sonra Əbu Bəsir atası İmam əl-Baqir’in fərqli cavab verdiyini söylədikdə İmam Cəfər təqiyyə “pərdəsini” qaldırır və daha əvvəlki cavabının təqiyyə ilə olduğunu etiraf edir. Belə bir ayıb əslində “əs-Sadiq” ləqəbli bir imama heç cür yaraşmaz. Bu daha çox dinin əhkamı ilə oyun oynamağa bənzəyir. Biz şəkk etmirik ki, bu rəvayətlər imamların adından uydurulmuş rəvayətlərdir və sünnət əhlinə müxalif olmaq üçün imamların verdikləri doğru hökmlərin sadəcə təqiyyə olaraq verildiyini göstərmək üçün uydurulub.

[1095] ət-Tusi, “əl-Ğeybə”, səh: 329;

şiddətləndi… Bir başqa dəlil budur ki, sünnilər deyərdilər ki, onun fətvaları (səhabə) Cabir vasitəsilə Allahın elçisindən - salləllahu aleyhi va əlihi va səlləm - götürülüb[1096]…"[1097] Bu mənanı həmçinin Muhəmməd Asif Muhsini'nin sözlərindən də anlaya bilirik. O, Cəfər əs-Sadiq'in imamlığı barəsində gəlmiş naslardan danışarkən onlardan yalnız ikisinin mötəbər olduğunu yazır və o ikisindən yalnız birinin Muhəmməd əl-Baqir tərəfindən öz oğlu Cəfərin imamlığı haqqında olduğunu qeyd edir və sonra deyir: "Bil ki, İmam əs-Səccad tərəfindən (oğlu) əl-İmam Baqir haqqında xüsusi nassın azlığı anlaşıla biləndir, çünki onun zamanında şiələr az idi və təqiyyə şiddətli idi. Amma (əl-Baqir tərəfindən) əs-Sadiq barəsində nassın azlığına gəldikdə isə bu, qəribədir. Üstün olan ehtimal budur ki, bu rəvayətlər bizim zamanımıza qədər gəlib çatmayıb."[1098] Muhsini etiraf edir ki, əs-Səccadın zamanında nassın az olmasını təqiyyə ilə izah edə bilir, amma əl-Baqir'dən nassın az olmasını təqiyyə ilə izah edə bilmir, çünki qəbul edir ki, Muhəmməd əl-Baqir'in zamanında təqiyyə olmayıb. Bunun bənzərini İmam Cəfər əs-Sadiq haqqında da demək mümkündür. Şeyx Abbas əl-Qummi'nin (h. 1359) aşkar etirafı buna şahidlik edir: "əs-Sadiqə insanlara oturub dərs vermək qadağan edildikdə bu, onun şiələrinə ağır gəldi. Sonra Allah əl-Mənsurun ürəyinə saldı ki, əs-Sadiqdən ona başqa heç kimdə olmayan bir şeyi ithaf etməsini istəsin. əs-Sadiq ona peyğəmbərə - aleyhissələm - aid qısa bir çomaq göndərdi, qol uzunluğunda idi və əl-Mənsur buna xeyli sevindi. Onun dörd yerə bölünməsini əmr etdi və onu dörd ayrı yerə payladı. Sonra ona dedi: "Sənin mənim yanımdakı yeganə mükafatın səni sərbəst buraxmağım və sənin elmini şiələrinə yaymağımız ola bilər, nə sənə, nə də onlara toxunmayacam. Çəkinmədən otur və insanlara fətva ver! Beləliklə də əs-Sadiq'dən elm yayıldı."[1099] Şiələr özləri də yazırlar ki, xəlifə əl-Mənsura qədər Cəfər əs-Sadiq üzərində siyasi bir təzyiq olmayıb və Abbas əl-Qummi hətta qeyd edir ki, Mənsur özü də sonradan bu təqibi

---

[1096] Şiələrin iddiasına görə isə səhabə Cabir bin Abdilləh əl-Ənsari öz elmini İmam Muhəmməd əl-Baqir'dən alırdı. Cabir vəfat edərkən 94 yaşına dolmuşdu və Muhəmməd bin Əli əl-Baqirin 21 yaşı var idi. Muhəmmədin səhabə Cabirdən rəvayət etdiyi hədislər sünnət kitablarında səhih hədislər arasında keçir. Cabir öyrənəcəyini Allahın elçisindən - salləllahu aleyhi va səlləm - öyrənmişdi, Muhəmməd əl-Baqir'i atası Cabirin yanına gətirərdi və Cabirdən elm öyrənərdi. Burada qəribə heç bir şey yoxdur.

[1097] əl-Bəhbəhəni, "Haşiyətu Məcmə əl-Fəidəti val-Burhən", səh: 374; Muəssəsətul-Bəhbəhəni, 1417

[1098] Muhsini, "Məşraətu Bihər əl-Ənvar", 2/166;

[1099] Abbas əl-Qumi, "əl-Ənvar əl-Bəhiyyə fi Təvarix əl-Hucəc əl-İləhiyyə", səh: 146; Darul-Ədva, Beyrut, 1984

aradan qaldırıb.[1100] Şeyx Muhəmməd Həsən əl-Muzaffər (h. 1375) isə yazır: "əs-Sadiqə gəldikdə o, həm əməvi, həm də abbasi dövlətlərində yaşayıb və bir zalımın şiddətindən və qəddarın təhdidindən qorxmayacağı bir dönəm görüb ki, bu dönəm əməvi dövlətinin sonları ilə abbasi dövlətinin əvvəllərinin qarışdığı dönəm idi. Çünki əməvilər və Şam əhli əl-Valid bin Yezidin sonuna çıxıb onu öldürdüklərində kənar bölgələrin əhalisi onlara qarşı ayağa qalxdılar, hakimiyyətlərinin sütunları zəiflədi. Haşim oğullarına dəstək ölkənin fərqli tərəflərində güclənmişdi. Bütün bu hadisələr əməvilərin diqqətini əs-Sadiq'in - aleyhissələm - elmi məşğuliyyətlərindən yayındırmışdı. Zaman əməviləri tərk edib abbasilərin xeyrinə çalışdıqda abbasilərin başı Yer üzünü əməvilərdən təmizləməyə və yeni dövlət qurmağa qarışmışdı. Sən bilirsən ki, yeni bir dövlətin qurulması və kök atması üçün uzun zamana ehtiyac duyulur. Onların əs-Sadiqin elmi fəaliyyətlərini görməməklərinin səbəbi bir müddət dövləti qurmaqla məşğul olmaqları və onun kontrolunu gücləndirməyə çalışmaqları idi, yoxsa əs-Səffah onu unutmamışdı, lakin ondan qorxmaq üçün heç bir əsas görməmişdi. əl-Mənsurun növbəsi gəldikdə və hakimiyyəti möhkəmləndikdə əs-Sadiqlə ədavət etməyə başladı, bəzən ona təzyiqlər göstərirdi, bəzən isə onu görməməzlikdən gəlirdi."[1101] Beləliklə də əs-Sadiq kiçik bir vaxt kəsimi istisna olmaqla elmi fəaliyyətinin böyük bir hissəsində siyasi təzyiq altında olmayıb.[1102] Necə təsəvvür etmək olar ki, bütün bu şərtlər çərçivəsində imamlar öz şiələrini qorumaq üçün, onları siyasi dairələrin gözündə ixtilafa düşmüş, zəif bir qrup kimi göstərmək üçün onlara batil

---

[1100] Çox qəribədir ki, elm cəhətdən Muhəmməd əl-Baqir üstün olmasına, oğlu əs-Sadiqə nisbətdə onun zamanında siyasi təqibin olmamasına baxmayaraq şiələr ondan daha az xəbər rəvayət ediblər. Şiələrdən Şeyx Azizullah əl-Ataridi imami kitablarından əl-Baqirin sənədli hədislərini toplayaraq onu "Musnəd əl-İmam əl-Baqir" adı ilə altı cilddə çap edib. Bunlardan yalnız bir cild yarımı fiqhi əhkamlara iddir. Eyni müəllif eyni üslub ilə əs-Sadiq'in də rəvayətlərini toplayıb və bu səfər cildlərin sayı 22-yə çatıb və onlardan doqquz cild fiqhi əhkama aiddir. Halbuki bunun əksini görməli idi.

[1101] əl-Muzaffər, "əl-İmam əs-Sadiq", 1/188-189;

[1102] Cəfər əs-Sadiq'in əhlul-beytin şərəfli nümayəndəsi kimi siyasi nəzarət altında olması danılmaz bir həqiqətdir. Lakin bu, təqiyyəyə səbəb olacaq bir təqib olmayıb. Çünki o, əl-Həsən'in övladları kimi siyasi liderlik iddiasında olmayıb, heç zaman qiyama cəhd etməyib, əhlul-beyt'dən üsyan edənlərə açıq bir dəstək verməyib. Ona görə də xəlifələr onu təhlükə kimi görmürdülər. Xəlifə əl-Mənsur'un Cəfər əs-Sadiqi dəfələrlə öz hüzuruna çıxarıb onu öldürmək istəməsi haqqında gələn rəvayətlərin isə heç biri şiələrin öz ölçülərinə görə səhih deyildir. Bunu Muhəmməd Asif Muhsini "Məşraatu Bihər əl-Ənvar" kitabında (1/169-170) deyir.

və ziddiyyətli fətvalar veriblər?! Əlbəttə ki, əhlul-beytin böyükləri haqqında bunu etiqad etməkləri onlara qarşı zülmdür.

İmam Cəfərin nəvəsi Əli ər-Rida'nın halı isə xüsusilə diqqətəlayiqdir, çünki abbasi xəlifəsi əl-Məmun onu özünün vəliəhdi elan etmişdi. Hətta abbasilər buna görə əl-Məmuna olan beyətlərini pozurlar, ona qarşı üsyan qaldırırlar və başqasına beyət edirlər. Şiələrdə əl-Alləmə əl-Hilli yazır ki, "(Musanın) oğlu Əli ər-Rida - aleyhissələm - öz zamanının ən zahid və elmlisi idi… əl-Məmun onun kamilliyini və fəzilətini bildiyi üçün onu (özündən sonra vəliəhd) təyin etdi…əl-Məmun onun ismini dirhəmlər və dinarlar üstünə yazdırdı, hər tərəfə xəbər göndərərək ona beyət edilməsini tələb etdi, qara rəngli geyimləri ataraq yaşıl geyindi…" Onun oğlu Muhəmməd əl-Cavvad haqqında yazarkən deyir ki, o "elmdə, dinində, zəkasının çoxluğunda və səxavətində atasının yolu üzərində idi. Atası Rida - aleyhissələm - vəfat etdikdə əl-Məmun onun oğlunu yaşının kiçikliyinə baxmayaraq elminə, dininə, zəkasının genişliyinə görə sevdi və onu qızı Ummul-Fədl ilə evləndirmək istədi, bundan əvvəl atası ər-Rida'nı (digər) qızı Ummu Həbib ilə evləndirmişdi…"[1103] əl-Miləni şərhində qeyd edir ki, Əli ər-Rida'nın qardaşı Zeyd hakimiyyətə qarşı üsyan etmişdi və Zeyd ən-Nər[1104] ləqəbi ilə tanınırdı, çünki qiyam etdiyi şəhərdə evləri yandırırdı. Xəlifə əl-Məmun onu ələ keçirdikdə onu bağışladı və qardaşı Əli ər-Rida'nın yanına göndərdi, lakin ər-Rida onunla bir daha danışmamağa əhd etdi.[1105] Görəsən ər-Rida nə üçün öz qardaşı ilə danışmaqdan imtina edirdi?! Bu açıq-aşkar dəlalət edir ki, İmam Əli ər-Rida'nın təqiyyə etməsi üçün heç bir səbəb yox idi.[1106] Lakin bütün bunlara

---

[1103] əl-Miləni, "Şərh Minhəc əl-Kəramə", 1/30;

[1104] Nər ərəb dilində atəş deməkdir.

[1105] Eyni mənbə, 1/265;

[1106] Əli bin Musa ər-Rida'nın zəhərlənərək ölməsinə dair şiə və sünni kitablarında yazılan xəbərlərə əsasən şiələrin əksəriyyəti onun zəhərlənərək öldürüldüyünə inanırlar. Lakin bu, doğru deyildir. ət-Tabəri tarixində (8/568) onun ölümünü yazarkən deyir: "Əli bin Musa çoxlu üzüm yedi, bundan sonra anidən öldü." Əbu Əli Miskəveyh də bunun eynisini "Təcəribul-Uməm" kitabında (4/141) yazır. İbn Tahir əl-Maqdisi yazır: "Onun ölüm səbəbində ixtilaf ediblər, kimisi zəhərləndiyini deyir, başqası isə üzüm yeyib öldüyünü deyir." (əl-Bəd vat-Tarix, 6/111) İbnul-Əsir "əl-Kəmil fit-Tarix" kitabında (5/504) yazır: "Deyirlər ki, əl-Məmun onu üzüm ilə zəhərlədi və Əli üzüm yeməyi sevərdi. Mənə görə bu çox uzaq ehtimaldır." Həmçinin İbn Xaldun (4/38) yazır: "Bu səhih deyildir, çünki əl-Məmun batil səbəblə qan axıtmaqdan, xüsusilə də əhlul-beytin qanını axıtmaqdan uzaq idi." Eləcədə Sibt İbn əl-Cəvzi tarixində (13/388) yazır ki, "bir qrup əl-Məmunun onu zəhərlədiyini iddia etdilər, heç də onların dedikləri kimi deyildir." Əlbəttə ki, əl-Məmun'un Əli ər-Rida'nı öldürməsi fərziyyəsi çox uzaq bir ehtimaldır, hətta bunun tarixi məlumatlar işığında

baxmayaraq Muhəmməd əl-Baqir, Cəfər əs-Sadiq, Əli ər-Rida kimi imamlardan sünnilərə müvafiq olan bütün xəbərləri "təqiyyə" deyərək izah edirlər. Bu barədə rəvayət kitablarında və onların şərhlərində o qədər misallar var ki, biz onların hamısını qeyd etməli olsaq cildlərlə dolu kitablar yazmaq mümkündür. Misal üçün əl-Məclisi'nin və başqalarının muvassəq hökmü verdikləri bir rəvayətdə Cəfər əs-Sadiq dəstəmazla bağlı deyir: "Əgər ayaqlarını yumadan əvvəl başını məsh

---

ziddiyyətli olduğunu demək olar. Üstəlik bəzi şiə alimləri də bu iddianın tarixi reallıqlarla uyğun gəlmədiyini deyirlər. Bu şiə alimlərin başında Seyyid Radiyyuddin İbn Tavus (589-664) və Əli bin İsa əl-İrbili (620-692) gəlir. əl-İrbili "Kəşf əl-Ğummə" kitabında (3/374) bu barədə əl-Mufid'in yazdıqlarını sitat gətirir və daha sonra deyir: "Etibar etdiyim birindən mənə çatan məlumata görə Seyyid Radiyyuddin Əli ibn Tavus - rahiməhullah - əl-Məmun'un Əlini zəhərləməsi (fərziyyəsi) ilə razılaşmırdı, buna inanmırdı. O, çoxlu mütaliə edən, bu kimi şeyləri incələyən və təftiş edən biri idi. əl-Məmun'un aşkar halından göründüyü kimi onu sevməsi, ona meyl etməsi, onu özü ailəsindən və övladlarından önə keçirməsi (İbn Tavusun) dediklərini dəstəkləyir." əl-İrbili qeyd edir ki, əl-Məmunun Əli haqqında fikrinin dəyişməsi ilə bağlı əl-Mufid'in - həmçinin digər şiə alimlərinin - gətirdiyi əsaslar tutarlı deyildir. əl-Mufid "əl-İrşad" kitabında (2/269) yazır ki, Əli ər-Rida xəlifə əl-Məmuna öyüd-nəsihət edirdi, onun etdiyi xətalara düzəlişlər edirdi, onu tənqid edirdi və əl-Məmun zahirdə bu halda razı olduğunu göstərsə də içində buna nifrət edirdi. Buna misal olaraq zikr edir ki, əl-Məmun bir dəfə dəstəmaz alarkən xidmətçi oğlanın onun əlinə su tökməsini görən Əli ər-Rida etiraz edir və deyir ki, "ey möminlərin əmiri, ibadətdə Rəbbinə şərik qoşma!" Bundan sonra əl-Məmun uşağı göndərdi və dəstəmazını özü tamamladı və bu, onun qəzəbini, hiddətini artırdı. Həmçinin iddia edir ki, Əli ər-Rida tez-tez Səhl'in iki oğlunu pisləyərdi, onların eyiblərini, çirkin əməllərini ifşa edərdi. əl-İrbili deyir ki, Əli ər-Rida "bu kimi şeylərə vaxt tapa bilməyəcək qədər dini, axirəti və Allahı ilə məşğul oldu. əl-Mufid'in öz rəyinə görə onun adını çəkdiyi dövlətinin əsası pozulmuşdu, qənaətbəxş bir bünövrə üzərində durmurdu, ona görə də Əlinin o ikisinə dil uzatması, nəticədə o ikisinin xəlifənin rəyini ona qarşı dəyişdirməsi tutarlı deyildir." Dəstəmazla bağlı iddia olunana gəldikdə isə əl-İrbili deyir: "əl-Məmuna ona dinində fayda verəcək bir şeyi nəsihət etməsi onu öldürməsi üçün səbəb olmağı və bu cür ağır bir cinayəti törətməyi gərəkdirməz. Bunun üçün sadəcə olaraq ona öz yanına daxil olmağı qadağan etməsi və öyüd-nəsihət etməyi qadağan etməsi kifayət edərdi. Bir başqa yerdə (3/425) əl-İrbili deyir: "əl-Məmun'un Zeydi tutub qardaşı (Əli)nin yanına göndərməsi, ondan əvvəl isə Cəfər (əs-Sadiq)in oğlu Muhəmmədi tutması, onların üsyan etməklərinə, xilafətə iddia etməklərinə, ölkəsində fəsad çıxarmaqlarına baxmayaraq onları bağışlaması bir daha əl-Məmunun Əliyə xəyanət etmədiyini, ittiham olunan işi görmədiyini deyənlərin arqumentlərinə güc qatır, çünki Muhəmməd və Zeyd nə Allaha, nə də (xəlifə) əl-Məmuna yaxınlıq baxımından Əli ər-Ridaya çata bilməzlər və Əli ər-Ridanın o ikisinin etdiyi günah kimi bir günahı yox idi, əksinə ümumiyyətlə heç günahı yox idi, o zaman necə olur ki, o ikisini bağışlayır, amma bunu öldürür?!" Əli ər-Rida öldükdən sonra əl-Məmun'un buna çox üzüldüyü, onun cənazəsini özünün qıldığı və onu Tus şəhərində atasının qəbri yanında dəfn etdiyi bilinir. Şeyx əl-Mufid özü "Təshih İtiqadət əl-İməmiyyə" kitabında (səh: 132) ər-Rida'nın zəhərlənməsinin "güclü" olduğunu yazsa da bunda şəkk olduğunu etiraf edir. Şiə alimi Yusuf əl-Bəhrani "əl-Hədəiq ən-Nədira" kitabında (17/437) yazır: "Bəzi xəbərlər onun zəhərlənərək öldüyünə, abbasi (xəlifə) əl-Məmunun onu zəhərlədiyinə dəlalət edir və əs-Saduq bu rəydə olub. Əshabımızın əksəriyyəti bunu zikr etməyib." Bu əksəriyyətin arasında "əl-Kafi" kitabının sahibi əl-Kuleyni də yer alır.

etməyi unutsan başını məsh et, sonra ayaqlarını yu!"[1107] ət-Tusi bu rəvayətlə bağlı deyir: "Bu xəbər sünnilərə müvafiqdir, təqiyyə məqamında varid olub, çünki imamların məzhəbindən məlum olan ayaqları yumaq yox, məsh etməkdir."[1108] Həmçinin Əli ər-Rida'ya nisbət olunan fiqh kitabında onun dəstəmazda həm ayaqları yumağın, həm də məsh etməyin icazəli olduğunu dediyi keçməkdədir. əl-Xavansəri etiraf edir ki, bu xəbərin sözləri təvilə yer buraxmayacaq şəkildə aşkardır.[1109] əl-Ayyəşi təfsirində Əli bin Əbi Həmzə'dən rəvayət edir: "Əbu İbrahimdən - aleyhissələm - dəstəmaz ayəsi haqqında soruşdum…" Rəvayətin axırında deyir: "Bəs ayaqlar? Dedi: "Onları yu!"[1110] ət-Tusi "əl-İstibsar" kitabında bu barədə gəlmiş digər rəvayətləri ya təqiyyə olaraq izah edir, ya da "yumağı" sadəcə təmizlik məqsədi ilə edilmiş bir əməl olaraq yozur.[1111] Bu rəvayətlərdən biri xüsusilə maraqlıdır, beləki orada Əli bin Əbi Talib'in belə dediyini rəvayət edir: "Mən dəstəmaz almaq üçün oturmuşdum və dəstəmaza yenicə başlamışdım ki, Rəsulullah - salləllahu aleyhi va əlihi - yaxınlaşdı. O mənə dedi: "Ağzını yaxala, burnuna su çək və sonra üfür." Mən üç dəfə yudum, o dedi: "İki dəfə bunun üçün kifayətdir." Sonra qollarımı yudum və başımı iki dəfə məsh etdim, o dedi: "Bir dəfə kifayətdir." Ayaqlarımı yuduqdan sonra o mənə dedi: "Ey Əli, barmaqlarının arasını təmizlə, onların cəhənnəm odu ilə təmizlənməsinə imkan vermə." Bunu dedikdən sonra ət-Tusi deyir: "Bu, sünnilərin rəyinə uyğun bir rəvayətdir və təqiyyə kontekstində nəql edilmişdir. İmamlarımızın - aleyhimussələm - məzhəbindən şübhə edilməyən və dəqiq olan budur ki, ayaqlara məsh çəkmək vacibdir və bu, o qədər məşhurdur ki, burada şübhə və ya tərəddüdə yer yoxdur."[1112] Belə çıxır ki, Əli bin Əbi Talib burada təqiyyə edib? Görəsən kimdən təqiyyə edib, əlbəttə ki, Allahın elçisinin - salləllahu aleyhi va əlihi va səlləm - qarşısında təqiyyə etməsi üçün bir səbəb yox idi. Ona görə də əl-Hurr əl-Amili bununla bağlı olaraq ət-Tusi'yə etiraz edir və deyir: "Diqqət et ki, o, bunu təqiyyə olaraq izah etmişdir, baxmayaraq ki, Şeyxin öz rəyinə görə, Peyğəmbər üçün belə bir şey icazəli deyil. Ancaq nadir kəslər müstəsna Şiələrin əksəriyyəti və ümumiyyətlə müsəlmanlardan

---

[1107] əl-Kuleyni, "əl-Kəfi", 3/35;
[1108] ət-Tusi, "Təhzibul-Əhkəm", 1/93-94;
[1109] "əl-Fiqh əl-Mənsub lil-İməm ər-Rida", səh: 34-35; Muəssəsətu Al əl-Beyt, Beyrut, 2010
[1110] "Təfsir əl-Ayyəşi", 1/301;
[1111] ət-Tusi, "əl-İstibsar", 1/65;
[1112] Eyni mənbə, 1/65-66; "Təhzibul-Əhkəm", 1/93-94;

heç kim bu izahı qəbul etmir. Bunun yeganə izahı budur ki, möminlərin əmiri, Hüseyn və Əli ibn Hüseyn - aleyhimussələm - bu rəvayəti təqiyyə səbəbindən sünnilərin rəvayət etdiyi kimi nəql ediblər. Eyni şəkildə, (peyğəmbərin və imamların) səhv etmələri haqqında olan rəvayətlər də təqiyyə çərçivəsində nəql edilən rəvayətlərdəndir."[1113] Bu kimi izahları oxumaq insanın təəccübünə təəccüb qatır. İmamların dəstəmaz kimi önəmli bir ibadətdə haqq olmayan xəbərlər rəvayət etdiklərini və bunu təqiyyə olaraq etdiklərini necə ağla gətirmək olar?! əl-Amili isə iddia edir ki, Əli bin Əbi Talib, Hüseyn və oğlu İmam Zeynul-Abidin hədisdə ayaqların məsh edildiyini bildikləri halda sünnilərdən təqiyyə edərək hədisdə məsh yerinə "yumaq" sözü işlədiblər. Beləliklə də insanlara doğru dəstəmazı yox, şiələrin inancına görə xətalı olan dəstəmazı öyrədiblər. Belə çirkin bir şeyi imamlara hansı vicdan ilə nisbət etmək mümkündür?! Onu da əlavə etməliyik ki, dəstəmazda ayaqları yumaq həmçinin zeydilərin də məzhəbidir. Onlar bunu öz kanalları ilə əhlul-beytin böyüklərindən, əl-Həsən və əl-Hüseyn'in övladlarından rəvayət edirlər. Zeydi imamlardan əl-Hədi Yəhya bin əl-Hüseyn yazır: "Atam mənə öz atasından belə dediyini rəvayət etdi: "Allahın elçisinin ailəsindən heç kimi Allahın elçisinin və Əli bin Əbi Talibin, onların ailələrinin hamısının, onlardan sonra mühacirlərin hamısının (dəstəmaz ayəsindəki) qiraətlərinin "va arculəkum" sözündə nasb ilə, üzü yumağa atf olaraq oxunmaq olmağında şəkk etdiyini görmədim… ayə yalnızca yumağı vacib edir…"[1114] Beləliklə də Yəhya bin əl-Hüseyn burada atasından, o da öz atası məşhur zeydi imam əl-Qasim bin İbrahim ər-Rassi'dən bu sözləri nəql edir və əl-Qasim bin İbrahim əhlul-beyt üzvüdür, şiələrin yeddinci imamı Musa əl-Kazım'ı görüb, ondan elm öyrənib. əl-Qasim deyir ki, peyğəmbərin ailəsindən heç kimi Quranda dəstəmaz ayəsini bu gün on iki imam şiələrinin oxuduqları kimi oxuyarkən görməyib, imami şiələrinin təfsir etdikləri kimi təfsir etdiklərini görməyib. Əgər sünni qaynaqları və zeydi şiələrinin qaynaqları bu nöqtədə ittifaq edirlərsə əhlul-beytin də bu məsələdə sünnilər kimi ayaqlarını yuduqlarını deyə bilərik, əks təqdirdə əl-Qasim bin İbrahim'in yuxarıdakı şahidliyi doğru olmazdı. Daha məntiqli olan budur ki, əl-Baqir və əs-Sadiq kimi imamlar da dövrün digər alimləri kimi ayaqları yumağın gərəkdiyini deyiblər, lakin onların

---

[1113] əl-Amili, "ət-Tənbih bil-Məlum", səh: 178;

[1114] Yəhya bin əl-Hüseyn, "Kitəbul-Əhkəm fil-Hələl val-Haram", 1/67-68; Məktəbətu Bədr, Sana, 2014

adından məzhəb icad etmək işi ilə məşğul olanlar sünnilərə müxalif olmaq üzərindən bir məzhəb ortaya çıxarıblar.

Şiə kitablarında keçən bir rəvayətdə Şueyb bin Yaqub əl-Aqraqufi deyir: “Əbu Abdilləhin yanında idim, Əbu Bəsir və Cəbəl əhlindən bir qrup da bizimlə idi. Ondan kitab əhlinin kəsdikləri haqqında soruşurdular. Əbu Abdilləh onlara dedi: “Allahın - azzə va cəllə - kitabında nə dediyini eşitmisiz.” Dedilər: “Sənin bizə xəbər verməni istərdik.” Dedi: “Yeməyin!” Biz onun yanından çıxdıqda Əbu Bəsir dedi: “Yeyin! Məsuliyyəti mənim boynumadır. Onu və atasını (kitab əhlinin kəsdiklərini) yeməyi buyurarkən eşitmişəm.” Bunun üzərinə geri qayıtdıq və Əbu Bəsir dedi: “Soruş” Mən də dedim: “Sənə fəda olum, kitab əhlinin kəsdikləri haqqında nə deyirsən?” Dedi: “Məgər bu səhər dediklərimə şahid olmadınmı?” Dedim: “Bəli.” Dedi: “Xeyr, yemə!”…”[1115] əl-Hurr əl-Amili yazır ki, “Əbu Bəsir’in rəvayəti təqiyyə mənasında anlaşılmalıdır.”[1116] Bu və bunun kimi rəvayətlər əsasında şiə alimləri bu məsələdə qədimdən bəri ixtilaf ediblər. əl-Alləmə əl-Hilli bu məsələdə şiə alimlərinin ixtilafına yer verir və qeyd edir ki, “alimlərimiz yanında məşhur olan kafirlərin kəsdiklərinin mütləq olaraq haram olmasıdır…” Daha sonra əs-Saduq’dan nəql edir ki, kitab əhlinin Allahın adını çəkərək kəsdiklərini yemək halaldır. Həmçinin İbn Əbi Aqil’dən yəhudi və xristianların ovladıqlarının və kəsdiklərinin halal olması rəyini zikr edir. Eləcədə İbnu əl-Cuneyd’dən bunun haram olmamasına dəlalət edən nəqlə yer verir. əl-Hilli özü daha sonra imamlardan kitab əhlinin kəsdiklərinin halallığına dair gəlmiş rəvayətləri bir-bir qeyd edir və onların səhih olduqlarını da təsdiqləyir. Lakin bu hədislərin ya zərurət halı olaraq anlaşılması gərəkdiyini, “ya da təqiyyə olaraq” anlaşılacağını yazır, “çünki sünnilərin məzhəbi bunun halal olduğunu deyir.”[1117]

Beləliklə də imamlardan gələn hansısa bir xəbər sünnilərə müvafiq olarsa bunu dərhal təqiyyə mənasına həml edirlər, yaxud da mənasını təhrif edəcək şəkildə yozurlar. Əlbəttə ki, bütün bu təqdim etdiklərimiz işığında bu “təqiyyə” iddiasının nə qədər tutarlı olduğunu sorğulamaq lazımdır. Əgər həbslər, işgəncələr qarşısında sünnilərin alimləri sınmayıblarsa, haqqı sonuna qədər hayqırıblarsa və sonunda zəfər çalıblarsa o zaman nə üçün Cəfər əs-Sadiq və ya Əli ər-Rida öz

---

[1115] əl-Mufid, “Zəbəih Əhl əl-Kitəb”, səh: 29;

[1116] əl-Amili, “Vasəil əş-Şiə”, 24/59;

[1117] əl-Hilli, “Muxtələf əş-Şiə”, 8/296-299;

canlarını qorumaq üçün millətə təqiyyə adi ilə batil dəstəmaz öyrədiblər?! Adi fiqhi məsələlərə görə siyasi dairələrin hansısa alimi təqib edəcəklərini düşünmək gülüncdür. O zaman ya əl-Bəhrani'nin dediyi kimi imamlar təkcə qorxu halında olduqları üçün yox, hətta öz şiələri arasında ixtilaf salmaq, onları vahid məzhəbdən uzaq tutmaq üçün də "yalan" danışıblar, batili təbliğ ediblər. Ya da qəbul etməliyik ki, imamların adına nisbət edilən bu rəvayətlər yalandır, onlar təqiyyə etməyiblər, məsum imamlıq iddiasında olmayıblar, onlar elə sünni alimlərindən fərqli olmayıblar. Yoxsa əks təqdirdə bu böyük şəxsiyyətlərə nisbət edilən yalanlar və təqiyyələr onlar üçün eyibdən başqa bir şey deyildir. Bu mənaya işıq salmaq istəyən Şihəbuddin əl-Alusi hansısa imamın qorxudan gedib gizlənməsi və qeybə çəkilməsi haqqında deyir: "Ölümdən gizlənməyin özü imkansızdır, çünki (şiələrin iddialarına görə) onların ölümləri öz seçimləri ilə olur. Əgər (gizlənməsi) sadəcə bədən əziyyətinə görədirsə belə bir nəticə ortaya çıxır ki, imamlar cihad ibadətindən və Allah uğrunda məşəqqətə qatlanmaqdan qaçıblar. Belə bir şey onlara heç yaraşmaz."[1118] Əhlüs-sünnət qaynaqları da onlara nisbət edilmiş bu təqiyyəni iftira və yalan olaraq görür. İmam əş-Şafi deyir: "Hətim (bin İsmail) bizə Cəfər bin Muhəmməd'dən, o da atasından xəbər verdi ki, əl-Həsən və əl-Hüseyn - radiyallahu təalə anhumə - Mərvanın arxasında namaz qılardılar. Dedi: "Məgər evlərinə qayıtdıqlarında namazlarını təzələmirdilər?" Dedi: "Xeyr, Allaha and olsun ki, imamların (qıldırdıqları) namazlara əlavə etmirdilər."[1119] Həmçinin İbn Sad deyir: "Şəbəbə bin Səvvar bizə xəbər verdi; dedi: Bəssəm (bin Abdilləh əs-Sayrafi) mənə xəbər verdi; dedi: Əbu Cəfər'dən əməvilərin arxasında namaz qılmaq barəsində soruşdum. Dedi: "Arxalarında namaz qıl, çünki biz onların arxasında qılırıq." Dedim: "Ey Əbu Cəfər, bir qrup insan iddia edir ki, siz bunu təqiyyə olaraq edirsiz." Dedi: "əl-Həsən və əl-Hüseyn Mərvanın arxasında namaz qılırdılar, sırada birinci durardılar. Hətta bəzən əl-Hüseyn onu minbərdə ikən ordan enənə qədər söyərdi. Məgər bu təqiyyədir?"[1120] Maraqlıdır ki, bu xəbərlər şiə qaynaqlarında da keçməkdədir. İsmail bin Musa öz atası Musa əl-Kazım'dan, o öz atasından, o da atası Muhəmməd əl-Baqir'dən belə dediyini rəvayət edir: "əl-Həsən və əl-Hüseyn Mərvan ibn əl-Həkəm'in arxasında

[1118] əl-Alusi, "ən-Nəfəhət əl-Qudsiyyə fi Raddil-İməmiyyə", səh: 23;

[1119] əş-Şafi, "əl-Umm", 1/185; Bunun həmçinin İbn Əbi Şeybə "əl-Musannəf" kitabında (2/152) Hətim'dən rəvayət edir.

[1120] Ibn Sad, "ət-Tabəqat əl-Kubra", 1/408 (rəq: 382) Məktəbətus-Siddiq

namaz qılardılar" və əcnəbilər ona (yəni İmam əl-Baqir'ə) dedilər: "Sənin atan evə qayıtdığında namazı (təkrar) qılmırdı?" Dedi: "Xeyr, Allaha and olsun ki, imamların namazından əlavə başqa namaz qılmırdı."[1121] Həmçinin İmam Cəfər əs-Sadiq'in oğlu Əli bin Cəfər öz kitabında qardaşı Musa'dan belə dediyini rəvayət edir: "Həsən və Hüseyn Mərvanın arxasında namaz qıldılar və biz də onlarla namaz qılırıq."[1122]

Diqqətimizi yönləndirməli olduğumuz daha bir maraqlı və qəribə məqam vardır. O da budur ki, şiə alimləri təqiyyə məsələsində peyğəmbərlər ilə imamlar arasında fərq qoyurlar. Qəribə olan budur ki, şiələr təqiyyəni peyğəmbərlər üçün icazəli görmürlər, amm imamlar üçün təqiyyəni icazəli, hətta vacib hesab edirlər. əş-Şəhid əs-Səni yazır: "Zəruri olaraq bilinməyən hökmləri bilmək üçün ilk növbədə fiqh kitablarına müraciət edilməlidir. Orada qeyd olunan ixtilaflı və icma ilə qəbul edilmiş məsələlər öz əsasına və qaynağına qaytarılmalıdır. Əgər hökm açıq mətnlə və ya ictihad yolu ilə Müqəddəs Quranda təsdiqini tapırsa, o zaman axtarılan hökm odur. Əks təqdirdə, Peyğəmbərin və ya İmamların sünnəsinə müraciət edilməlidir, və onlar arasında heç bir fərq yoxdur; istisna olaraq tək bir fərq budur ki, Peyğəmbərin sünnəsi üç formada tətbiq edilir: söz, əməl və təsdiq, çünki Peyğəmbərin - salləllahu aleyhi va əlihi - təqiyyə etməsi icazəli deyil. İmamların sünnəsi barəsində isə təqiyyə ilə əlaqədar hallar və təqiyyə olmayan hallar arasında fərq qoyulmalıdır, çünki onlara - əleyhimussələm - təqiyyə etmək vacib idi."[1123] Məlumdur ki, peyğəmbərlərin təqiyyə etməsi icazəli deyildir. Muhəmməd Hüseyn əl-Hairi yazır: "Yalanın pisliyini aradan qaldıran yeganə faktorun zərurət olduğu sübut edildikdə, bunun, Onun (Allahın) tərəfindən baş verməsi imkansız olur, çünki zərurət Ona aid edilə bilməz. Çünki O, hər şeyə qadirdir və nə göylərdə, nə də yerdə Onu aciz edə biləcək bir şey yoxdur. Buradan da məlum olur ki, təqiyyə bəhanəsi ilə olsa belə, peyğəmbərlər üçün yalan söyləmək mümkün deyil, baxmayaraq ki, yalanın pisliyini aradan qaldıran zərurət onların haqqında da baş verə bilər. Çünki möcüzələr dəlalət edir ki, Uca Allah onların iddia etdiklərini və xəbər verdiklərini təsdiqləyir. Yalançını isə təsdiq etməyin - yalnız zərurət halı istisna

---

[1121] İbn Əşas, "əl-Cəfəriyyət", 1/127; Kərbəla, 2013; Fədlullah ər-Ravəndi, "ən-Nəvadir", səh: 163;

[1122] əl-Hurr əl-Amili, "Vasəil əş-Şiə", 5/383; Seyyid əl-Xomeyni bu rəvayətin səhih olduğunu deyir. Bax: əl-Xomeyni, "ər-Rasəil", 2/198;

[1123] əş-Şəhid əs-Səni, "Həqaiq əl-İmən", səh: 189;

olmaqla - pis olduğu şübhəsizdir; çünki bu, yalanla eyni mənadadır və artıq bildiniz ki, zərurət Ona aid edilə bilməz. Üstəlik, əgər təqiyyə peyğəmbərlər üçün icazəli olsaydı, onların göndərilməsinin faydası aradan qalxardı və bu da onların göndərilməsinin hikmətinə ziddir."[1124] ət-Tabərsi təfsirində yazır: "Sonra Uca Allah keçmiş peyğəmbərləri təsvir etdi və onları tərifləyərək buyurdu: 'Onlar Allahın risalələrini çatdırırlar'—yəni, onlar risalələri göndərildikləri insanlara çatdırır və onları gizlətmirlər. 'Və Ondan qorxurlar'—yəni, Allahın onlara vacib etdiyi şeyi tərk etməməkdə Ondan qorxurlar. 'Və Allahdan başqa kimsədən qorxmurlar'—yəni, çatdırmaq və təbliğ məsələlərində Allahdan başqa heç kimdən qorxmurlar. Bu da göstərir ki, peyğəmbərlər risalənin təbliği məqamında təqiyyə edə bilməzlər."[1125] Ortaya belə bir sual çıxır ki, nə üçün peyğəmbərlərə təqiyyə haram olduğu halda, imamlar üçün icazəli, hətta vacibdir? Bu sualın cavabını bizə əş-Şərif əl-Murtəda verməyə çalışacaq. Beləki o yazır: "Onun "Əgər təqiyyə İmamlar üçün icazəlidirsə və onların məsumluğu sizin dediyiniz kimidirsə, onda təqiyyə Peyğəmbər üçün də icazəli olmalıdır" sözünə gəldikdə isə, burada iki məsələ arasında aşkar bir fərq vardır. Peyğəmbər - salləllahu aleyhi va əlihi - şəriətin qurucusudur və yalnız onun vasitəsilə bilinən hökmləri ilk dəfə izah edən şəxsdir. Əgər təqiyyə ona icazəli olsaydı, bu, mükəlləflərin vəzifələrini aydınlaşdırmağı əngəlləyərdi və onlar dini mənafelərini başa düşmək yolunu itirərdilər, çünki bu, yalnız Peyğəmbərin vasitəsilə mümkündür. İmam isə bu məsələdə fərqlidir, çünki o, artıq başqalarından məlum olan şəriətləri tətbiq edir və onun sözlərindən başqa yollarla bu hökmləri öyrənmək mümkündür. Buna görə də, İmam bəzi hökmlərdə haqlı bir səbəblə təqiyyə edərsə, bu, haqqı bilmək və ona çatmaq imkanını əngəlləmir. İmam və Peyğəmbər məsumluqda eyni olsalar da, təqiyyənin icazəliliyi baxımından eyni olmaları lazım deyil, çünki arada biz qeyd etdiyimiz fərq mövcuddur. İmamın təqiyyəsi onun məsumluğu ilə əlaqəli deyil, çünki məsumluq təqiyyənin icazəliliyi və ya icazəsizliyinə təsir göstərmir. Əgər desələr ki, "məgər siz İmamın şəriət məsələlərində hüccət olduğuna inanmırsınızmı? Sizə görə elə bir vəziyyət ola bilər ki, nəql edənlər nəql etmədikləri üçün, yalnız etibarsız kəslərdən varid olduğu üçün haqqı orda yalnız İmamın sözlərindən və bəyanından bilmək mümkün olsun və bu, ikisini ayırdığınız nöqtədə İmamın Peyğəmbərlə eyni olmasını gərəkdir". Biz belə cavab verərik: Əgər

---

[1124] əl-Hairi, "əl-Fusul əl-Ğaraviyyə fil-Usul əl-Fiqhiyyə", səh: 320;

[1125] ət-Tabərsi, "Məcmə əl-Bəyan", 8/165;

İmamın vəziyyəti sizin təsvir etdiyiniz kimi olsa və yalnız onun sözləri ilə sübut təyin olunarsa, onda təqiyyə onun üçün də icazəli olmaz, eynilə Peyğəmbər üçün də icazəli olmadığı kimi."[1126] Buradan başa düşürük ki, imama hər mövzuda təqiyyə etmək icazəli ola bilməz, əgər şəriətin hansısa məsələsində təqiyyə etmək həmin məsələdə haqqın nə olduğunu öyrənmək yoluna xələl gətirərsə, yəni məsələni öyrənmək istəyənlərin şübhəyə düşməsinə səbəb olarsa orada təqiyyə etmək olmaz. Lakin görəsən əş-Şərif əl-Murtəda'nın verdiyi bu izah reallığı əks etdirirmi? İmamlar həqiqətən də bu qaydaya riayət ediblərmi?! Həmçinin əl-Hairi deyir: "İmama gəldikdə isə, vəziyyət belə deyil. Aradakı fərq ondadır ki, peyğəmbər, ilahi lütf prinsipi əsasında haqqı aşkar etmək, batili məhv etmək, hüccəti tamamlamaq və onun risalətinə iman edənlər və inkar edənlər üçün - şərrindən əmin olub olmamasından asılı olmayaraq - bəhanələri aradan qaldırmaq üçün təyin olunmuşdur. İmama gəldikdə isə, o da Rəsulun - sallallahu əleyhi və alih - yerinə keçərək, bütün insanlara itaət edilməsi vacib olan ümumi rəhbər olsa da, onun mövqeyi - imkanı olduqda və zərərdən əmin olduqda - şəriət hökmlərini və sirlərini daşıyan, yaxşılığı əmr edib pislikdən çəkindirən alimlər mövqeyidir. Buna görə də, əgər onlar sözlərində təqiyyə etməyə məcbur qalsalar, təlmih (tövriyə) yolu ilə bu, onlar üçün icazəli olur. Bunun sirri budur ki, hüccət peyğəmbərin - salləllahu aleyhi va əlihi - bəyanı ilə tamamlanmış və insanlara vacib olmuşdur."[1127] əl-Hairi'nin, həmçinin əl-Murtəda'nın verdiyi izahlar şiə məzhəbi baxımından ciddi problemlərlə qarşılaşır. Hər şeydən əvvəl onların öz sözlərindən zəruri olaraq çıxan nəticə budur ki, imamlar mütləq dərəcə baxımından peyğəmbərlərdən kiçik olmalıdırlar. Çünki onların haqqında təqiyyəni mümkün saymaq üçün onları peyğəmbərlik dərəcəsindən çıxarıb "üləma" dərəcəsinə endirmək yalnız və yalnız bu mənaya dəlalət edir. Burada şiə alimləri iki ehtimalla qarşı-qarşıyadırlar, bunun üçüncüsü ola bilməz. Birinci ehtimal budur ki, peyğəmbərlər risalənin təbliğində mütləq ismətə (məsumluğa) malikdirlər, bu isə onları zərərdən və insanlardan qoruyur ki, onlar Rəblərinin risalələrini çatdırsınlar. Belə bir xüsusiyyət isə göstərir ki, imamlar mütləq ismət dərəcəsinə çatmırlar, çünki onlara özlərini qorumaq üçün təqiyyə etmək icazəlidir. Bu da peyğəmbərlərlə İmamlar arasında ismət dərəcələrinin fərqli olduğunu göstərir və şiə alimlərinin çoxunun iddia etdiyi kimi, peyğəmbərlərlə imamların məsumluq

[1126] "əş-Şəfi fil-İmamə", 4/105;

[1127] əl-Hairi, "əl-Fusul əl-Ğaraviyyə fil-Usul əl-Fiqhiyyə", səh: 320;

baxımından bərabər olması iddiasını təkzib edir. Həmçinin, bu, İmamiyənin təbliğ etdiyi "nəfs fəlsəfəsini "– yəni İmam Əlinin peyğəmbərlə eyni nəfs olmasını - inkar edir. Bundan əlavə, bu, onların İmamətin məqamının peyğəmbərlik məqamından daha yüksək olması ilə bağlı etdikləri iddiaları da inkar edir, çünki peyğəmbərlik risalənin təbliğində mütləq ismətə malikdir, lakin imamlar bu xüsusiyyətə sahib olmayıblar. Bu həm də imamların peyğəmbərlər kimi mütləq itaətə malik olması ilə bağlı edilən iddianı da təkzib edir, çünki əgər təqiyyə onlar üçün icazəlidirsə bu, insanların haqq olmayan şeylərdə onlara itaət etməklərinə səbəb olur və bu, şəriətin məqsədinə ziddir. Bundan başqa, bu, onların İmamların Allahın hökmlərinin tətbiqçisi və Allahın şəriətini qoruyan hüccətləri oması fikrini də yalanlayır, çünki "təqiyyə ehtimalı" onlardan gələn xəbərlərə şübhə toxumu səpir və imamların dini və siyasi rəhbərliyi ilə təqiyyə ehtimalı bir araya sığmır. Buna görə də şiə alimi əl-Bəhrani - daha əvvəl ondan nəql etdiyimiz kimi - bütün bəlaların kökündə təqiyyənin durduğunu deyir.

İkinci ehtimal: Peyğəmbərlər Allaha olan iman və qorxunun elə bir dərəcəsinə çatmışlar ki, onların bu imanları onları təqiyyədən qoruyur və beləliklə də Rəblərinin risalələrini insanlara vacib olduğu kimi çatdırırlar. Belə ki, onlar Allahdan başqa heç kimdən qorxmazlar və heç bir qınaqdan çəkinməzlər. Belə bir ehtimal imamların Allaha olan iman və qorxunun ən yüksək dərəcələrinə çatmadığını göstərir, halbuki bu dərəcəyə bir çox möminlər çatmışdır. Allah buyurur: 'Allahdan ən çox Onun alim qulları qorxar. Həqiqətən Allah izzətlidir və bağışlayandır' (Quran, Fatir: 28). Bu isə yenə "nəfs fəlsəfəsini" və İmamətin peyğəmbərlikdən daha üstün bir məqamda olması fikrini yalanlayır. Bu baxımdan onlar Allahın yer üzündəki hüccətləri ola bilməzlər.

Biz bilirik ki, imami fiqhində təqiyyə səbəbilə ciddi bir qarışılıq və xaos hökm edir və bu barədə şiə alimlərinin etirafları ilə tanış olduq. Gəlin əş-Şərif əl-Murtəda'nın bir başqa sözlərinə bir daha nəzər salaq və onu reallıqla müqayisə edək. O deyir: "Əgər deyilsə ki, "İmama təqiyyə icazəli olduğu halda, onun məzhəbi və etiqadı necə bilinə bilər və onun təqiyyə ilə verdiyi fətvaları digərlərindən necə ayırd edə bilərik?" Cavab verərik: İlk növbədə deyirik ki, İmam, yalnız onun vasitəsilə bilinən və yalnız onun sözü ilə əldə edilə bilən məsələlərdə təqiyyə edə bilməz. Yalnız sübutlarla və açıq dəlillərlə daha əvvəldən bəyan edilmiş məsələlərdə təqiyyə etmək onun haqqında icazəli ola bilər ki, onun verdiyi fətvalar, haqqa götürən yolların bağlanmasına və

şübhələrə qapanmağa səbəb olmasın."[1128] Bu, onun yuxarıda dediyi sözlərinin davamıdır və burada da təsdiq edir ki, insanları dini məsələlərdə şübhəyə salacaq şəkildə təqiyyə etmək etmək imamlar üçün halal olmamalıdır. Lakin bizim indiyə qədər oxuduqlarımızdan və sizinlə bölüşdüklərimizdən aşkar şəkildə ortaya çıxan mənzərə budur ki, imamiyyə fiqhindəki şübhələrin ən əsas səbəbi elə məhz bu təqiyyədir. əş-Şərif əl-Murtəda özü bundan xəbərdardır, lakin oxucusuna təqdim etdiyi izahlarda səmimi davranmır, bu həqiqətləri gizlədir. Ona görə də kitabları arasında bu mövzuda aşkar ziddiyyətlərlə qarşılaşırıq. Misal üçün bir yerdə əş-Şərif əl-Murtəda dən bitkilərindəki zəkatla bağlı bəzi şiə alimlərinin müxalif olmasına və bunun səbəblərinə toxunarkən deyir: "Əgər deyilsə ki, imamiyyə məzhəbində icma olduğunu necə iddia edirsiniz, halbuki İbn əl-Cuneyd burada müxalifdir və zəkatın yalnız qeyd etdiyimiz doqquz növdən deyil, torpağın çıxardığı bütün dənlərdə vacib olduğunu deyir. O, bu barədə imamlarınızdan - aleyhimussələm - çoxlu rəvayətlər nəql etmiş və Yunusun da bu mövqedə olduğunu bildirmişdir. Biz deyirik: İbn əl-Cuneydin və Yunusun şaz olan fikirlərinə əhəmiyyət verilmir, hətta Yunus onunla razılaşsa belə. İmamiyyənin məzhəbindən zahir olan bizim nəql etdiyimizdir. İmamiyyənin icması İbn əl-Cuneyd və Yunusdan əvvəl və sonra mövcud idi. İbn əl-Cuneydin İmamiyyə şiələrindən gətirdiyi rəvayətlər isə onların məşhur və tanınmış rəvayətləri arasındakı daha zahir, daha çox və daha güclü olanlarına ziddir. Üstəlik, bu rəvayətləri təqiyyə çərçivəsində başa düşmək olar, çünki İmamiyyə məzhəbinin əksəriyyətinə müxalif olan məzhəblər dənlərin bütün növlərində zəkatın vacib olduğunu qəbul edirlər, onlardan yalnız nadir və şaz olanlar İmamiyyə ilə razılaşır."[1129] Görəsən əl-Murtəda necə qəbul edə bilir ki, imamların bu məsələdə təqiyyə etməkləri bəzi şiə fəqihlərini şübhəyə salıb?! Halbuki özünün qoyduğu qaydaya əsasən imamlar kimisə şübhəyə sala biləcək şəkildə təqiyyə etməməlidir. Şiə alimlərinin isə təqiyyə səbəbilə nə qədər məsələdə ixtilaf etdiklərini göstərməli olsaq ayrıca kitab yazmalı olardıq. Bunun bir çox misalları ilə artıq tanış olmuşuq.

Burada Cəfər əs-Subhani'nin sözü yerinə düşür. O, təqiyyəni məhdudlaşdırmaq üçün yazır: "Lakin dini biliklərin açıqlanmasında və İslam hökmlərinin öyrədilməsində təqiyyə etmək qətiyyən caiz deyil. Məsələn, bir şiə aliminin təqiyyə əsasında kitab yazması və həmin

---

[1128] "əş-Şəfi fil-İmamə", 4/108;

[1129] əl-Murtəda, "əl-İntisar", səh: 210; Muəssəsətun-Nəşr əl-İsləmi, Qum, 1415;

kitabda yanlış əqidələri və sapqın hökmləri şiələrin əqidəsi və hökmləri kimi təqdim etməsi caiz deyil. Buna görə də görürük ki, şiə alimləri ən çətin şəraitdə belə öz həqiqi əqidələrini açıq şəkildə bəyan etmişlər. Şiə tarixində heç vaxt bir şiə alimi təqiyyə bəhanəsi ilə öz məzhəbinin əqidələrinə zidd olan bir risalə və ya kitab yazmamışdır. Başqa sözlə, zahirdə bir şey deyib, batində başqa bir şey söyləmək kimi bir hal olmamışdır. Əgər kimsə belə bir iş görsə və bu yolu tutsaydı, o, şiə imamiyyə məzhəbindən xaric edilərdi."[1130] əs-Seyyid Səmir Haşim əl-Umeydi də yazır: "Müctəhidin - xüsusilə də o müctəhid ümumi camaat tərəfindən izlənilən biridirsə - təqiyyə bəhanəsi ilə haram olmayan bir şeyi haram elan edən fətva verməsi qadağandır. Əgər o, öz fətvasını həyatı boyunca geri ala bilmirsə, bu fətva ümumi olaraq insanları narahat edəcək və onların əməli üçün əsas olacaqsa, bu halda, hər hansı bir vasitə ilə - hətta təqiyyəni tərk etmək ölümə səbəb olsa belə - təqiyyədən qaçmaq vacibdir."[1131] əs-Subhani'nin və əl-Umeydi'nin bu dediklərini şiə alimlərinin kitablarında imamlara nisbət etdikləri ilə müqayisə etdikdə çox qorxunc bir nəticə ortaya çıxır. Şiə alimi ən-Nəcəfi əl-Cəvahiri yazır: "Zürarə və Məhəmməd bin Müslim'in Əbu Cəfərdən - aleyhissələm - nəql etdiyi həsən rəvayətdə, onlar ondan evcil eşşəklərin əti haqqında soruşduqda, o dedi: "Yalnız Allah Təalanın Quranda haram etdiyi şeylər haramdır." Zurara'nın iki imamdan - aleyhiməssələm - birindən rəvayət etdiyi digər bir səhih rəvayətdə isə belə deyilir: "Qarğa yemək haram deyil, çünki yalnız Allahın Kitabında haram etdiyi şeylər haramdır. Lakin insanlar çox vaxt belə şeylərdən ikrah hissi ilə çəkinirlər." Bu və digər oxşar rəvayətlər ya təqiyyə məzmununda başa düşülür, ya da rədd edilir — onların heç bir izahı yoxdur… Əbu Abdullahdan - aleyhissələm - rəvayət edilən digər bir səhih rəvayətdə deyir: "Allah Rəsulu - salləllahu aleyhi va əlihi - təbiətcə bəzi şeylərdən çəkinərdi və onları xoşlamazdı, lakin onları haram etməzdi. Məsələn, ona dovşan gətirildi və onu bəyənmədi, lakin onu haram etmədi." Bu rəvayət də təqiyyə məzmununda başa düşülməlidir."[1132] Yaxud da Nəcmuddin ət-Tabəsi yazır: "Əbu əl-Həsəndən - aleyhussələm - rəvayət olunur ki: "Allah Rəsulu - salləllahu aleyhi va əlihi - Aşura günü oruc tutdu." Məclisi bu rəvayəti təvsiq edərək belə dedi: "Bu, muvassəqdir." Lakin Muhaqqiq əl-Qummi və

[1130] əs-Subhəni, "əl-Aqidə əl-İsləmiyyə", səh: 277;

[1131] əl-Umeydi, "ət-Təqiyyə fil-Fikr əl-İsləmi", səh: 103;

[1132] əl-Cəvahiri, "Cəvahirul-Kələm", 36/296;

başqaları bu rəvayəti təqiyyə ilə izah ediblər."[1133] Şeyxut-Taifə ət-Tusi deyir: "Məhəmməd bin Əhməd bin Yəhya'nın Əbu Cəfərdən, onun Əbu əl-Cövzadan, onun Hüseyn bin Əlvandan, onun isə Əmr bin Xalid vasitəsilə Zeyd bin Əlidən, onun isə əcdadlarından - aleyhimussələm - nəql etdiyi rəvayətə gəldikdə isə, orada bir kişi gəlib deyir ki, o, bir heyvanı kirayə götürmüşdü və heyvan ölmüşdü. Kişi heyvanı təyin edilmiş vaxtdan çox saxladığını etiraf edir, ona heyvanın dəyərini ödətdirdi, lakin artıq saxladığı zamana görə kirayə haqqı ödətdirmədi." Bu rəvayətin izahı budur ki, bu, təqiyyənin bir növüdür, çünki bu, sünnilərdən bir çoxunun məzhəbinə uyğundur."[1134] Ümumiyyətlə ət-Tusi "Təhzibul-Əhkam" kitabında 241 yerdə, "əl-İstibsar" kitabında isə 324 yerdə müxtəlif xəbərləri təqiyyə olaraq izah edib. əl-Hurr əl-Amili isə "Vasəil əş-Şiə" kitabında 500-dən çox yerdə təqiyyəni izah olaraq işlədib.

## Birinci misal: Quranın təhrifi

Şiə rəvayət kitablarında imamların adından uydurulmuş rəvayətlərin çoxluğunu göstərmək istəsək bunun üçün bəlkə də verə biləcəyimiz ən yaxşı misal Quranın təhrifi iddiasıdır. Bu rəvayətlər sayca və növcə o qədər çoxdur ki, onların hamısını təhlil etmək ayrıca bir kitab yazılmasını tələb edir. Şiələrin mühəddis alimləri arasında bu rəvayətlərin şiə kitablarında mütəvatir dərəcəsinə çatdığını deyənlər var. Misal üçün əl-Məclisi deyir: "Mənə görə bu mövzudakı xəbərlər mənəvi mütəvatir dərəcəsindədir."[1135] Əbul-Həsən əl-Amili, Nimətullah əl-Cəzairi, Adnan əl-Bəhrani və başqaları bu xəbərlərin təvatür və qətiyyət ifadə etdiyini bu və ya digər formada iddia edirlər.[1136] Yusuf əl-Bəhrani'nin nə dediyinə diqqət edək: "Bu

---

[1133] ət-Təbəsi, "Saumul-Aşura beynəs-Sunnətin-Nəbəviyyə val-Bidətil-Əməviyyə", səh:48;

[1134] ət-Tusi, "əl-İstibsar", 3/135;

[1135] əl-Məclisi, "Miratul-Uqul", 12/525;

[1136] Bax: əl-Amili, "Muqaddimətu Təfsir əl-Quran", səh: 62; əl-Cəzairi, "əl-Ənvar ən-Numəniyyə", 2/357; əl-Bəhrani, "Məşəriq əş-Şumus əd-Duriyyə", səh: 126;

rəvayətlərdə bizim seçdiyimiz mövqeyi və söylədiklərimizin aydınlığını dəstəkləyən açıq dəlillər və aydın ifadələrin olması heç kimə gizli olmamalıdır. Əgər bu rəvayətlərin çoxluğuna və yayğın olmağına baxmayaraq onlara şübhə ilə yanaşmaq olarsa, o zaman aydın oldur ki, dini rəvayətlərin hamısına şübhə ilə yanaşmaq mümkün olmalıdır, çünki mənbələr eynidir, eləcədə rəvayət yolları, ravilər və şeyxlər və nəql edənlər də eynidir. Allaha and olsun ki, dəyişiklik və təhrifin olmamasını demək, zalım xəlifələr haqqında gözəl zənn etmək, dinə zərəri daha böyük olan digər əmanətə xəyanət etməklərinə baxmayaraq ən böyük əmanətə xəyanət etməmişlər deməkdir."[1137] əl-Bəhrani çox haqlı bir problem ortaya qoyur ki, əgər bu qədər xəbər yalan və xəta ola bilərsə o zaman digər rəvayətlərin də yalan və xəta olması mümkündür. Əbul-Qasim əl-Xoyi bu hədislərdən bəzilərinin sənədlərinin mötəbər olduğunu etiraf edir.[1138] Muhəmməd Hüseyn ət-Tabətabəi bu rəvayətlərin içində təhrifə dəlaləti çox aşkar olan, sənədi səhih olan rəvayətlərin şaz və nadir olduqlarını qeyd etdikdən sonra deyir: "Bu növün şaz və nadir olmasından ziyadə uydurulmuş və saxtakarlıqla daxil edilmiş rəvayətlərdən olmamasına qarantiya yoxdur, çünki israiliyyatın və bura aid edilə biləcək uydurma, saxtalaşdırılmış rəvayətlərin bizim rəvayətlərin içinə dalması inkar edilməsi mümkün olmayan bir həqiqətdir. Uydurma, saxta olmasından əmin ola bilmədiyimiz bir xəbərin heç bir hücciyyət dəyəri yoxdur… Xülasə budur ki, (bu rəvayətlərin) saxta olması ehtimalı - ki, bu ehtimal çox güclüdür, şahidlər və qarinalar ilə dəstəklənir - bu rəvayətlərin hüccətliyini dəf edir və etibarını pozur. Bununla da onların, hətta isnadı səhih olanların nə şəri hücciyyəti, nə də əqli hücciyyəti qalmır. Çünki isnadın səhihliyi, ravilərin ədaləti sadəcə olaraq onların bu yalanları qəsdən deməkləri ehtimalını dəf edir, amma başqalarının onların rəvayət etmədiklərini onların əsli əlyazmalarına və kitablarına hiylə yolu ilə daxil etməklərini dəf etmir."[1139] Beləliklə də ət-Tabətabəi qeyd edir ki, Quranın təhrifi ilə bağlı xəbərlər uydurmadır, hətta onların içindən səhih isnadı olanlar da uydurmadır, onu saxtakarlar etibarlı ravilərin kitablarına daxil ediblər. Təsəvvür edin ki, saxtakarların "xəbər uydurma" əməliyyatı şiə məzhəbində mənəvi mütəvatir dərəcəsinə çatacaq xəbərləri ortaya çıxara bilib. Əgər Quranın təhrif olunması haqqında bu qədər yalan rəvayət uydurulubsa, hətta bunlardan bəziləri

[1137] əl-Bəhrani, "əd-Durar ən-Nəcəfiyyə", səh: 298; Mussəsətu Al əl-Beyt
[1138] əl-Xoyi, "əl-Bəyan fi Təfsir əl-Quran", səh: 226; Ənvar əl-Hudə, 1401;
[1139] ət-Tabətabəi, "əl-Mizən fi Təfsir əl-Quran", 12/112-115;

isnad baxımından əl-Xoyi kimi hədis alimlərinin nəzərində etibar qazanıbsa o zaman digər rəvayətlərə necə etibar etmək olar?!

## İkinci misal: Ramazanın günlərinin sayı

Bir başqa misal ramazan ayının günləri ilə bağlıdır. Şiə məzhəbində hicri ikinci əsrdən başlayaraq beşinci əsrə qədər bu məsələdə şiddətli bir ixtilaf olub və ixtilafın səbəbi isə şiə kitablarında ramazan ayının günlərinin sayının hər zaman otuz olması ilə bağlı rəvayətlərin çoxluğudur. əl-Behbudi deyir: "Təəssüf ki, bizi oruc günümüzdə yedirən və yemək günündə isə oruc tutduran bu hədisləri sünnət əhlinin rəvayətlərindən çox şiələrin rəvayətlərində görürük; onları müxtəlif isnadlar və müxtəlif üslublar ilə görürük."[1140] Mütəvatir dərəcəsinə çatdığı iddia olunan bu rəvayətlərə əsaslanaraq şiə alimləri erkən bir zamanda ramazan ayında oruc günlərinin sayının hər zaman otuz olduğunu deyiblər. Hətta bununla razılaşmayan şiələrə qarşı boykot çağırışları da olub. Şeyx əs-Saduq bu rəvayətləri qeyd etdikdən sonra deyir: "Kim bu xəbərlərə müxalif olarsa və bunlara zidd olaraq sünnilərə müvafiq olan xəbərlər ilə əməl edərsə, sünnilərə qarşı edilən təqiyyə bunlara qarşı da edilməlidir və bunlarla kim olmağından asılı olmayaraq yalnız təqiyyə ilə danışılmalıdır. Öyrənmək üçün sual verənlər istisnadır, onlara öyrədilməlidir və izah olunmalıdır. Çünki bidət yalnız onun haqqında danışılmadıqda yox olub itir."[1141] Eyni müəllif "əl-Xisal" kitabında deyir: "Şiələrdən xas olanların və bəsirət sahibi olanların ramazan ayı haqqındakı məzhəbi budur ki, ramazan ayı heç zaman otuz gündən qısa olmur. Bu barədəki xəbərlər Qurana müvafiq və sünnilərə isə müxalifdir. Ramazan ayının otuzdan az ola biləcəyini, digər aylar kimi artıb azalacağını deyən və təqiyyə ilə deyilmiş xəbərlər ilə əməl edən zəif şiələr isə sünnilər kimi təqiyyəyə məruz qalmalıdırlar. Onlarla sünnilərlə danışıldığı kimi danışılmalıdır."[1142] Digər tərəfdən isə Şeyx əl-Mufid ramazanın hər zaman otuz gün olduğunu deyənlər haqqında buyurur ki, onlar

---

[1140] əl-Behbudi, "Mərifətul-Hədis", səh: 14;

[1141] əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", 2/171; Camaatul-Mudərrisin, Qum

[1142] əs-Saduq, "əl-Xisal", 2/531-532; Camaatul-Mudərrisin, Qum, 1403

“Quranın nassına və ərəb dilinə müxalif oldular, bu barədə qəbul etdikləri rəyləri ilə İslam alimlərinin hamısından fərqləndilər və astronomlardan ayrı düşdülər; beləliklə də nə müsəlmanlara, nə də müşahidə və hesablamaya əsaslanan astroloqlara müvafiq olmadılar. Astronomiya elminə iddia etdilər, sonra ikisi arasında gedib gəldilər, nə bu tərəflik, nə də o tərəflik oldular. Ağla batmaz bir məzhəb çıxardılar və bu məzhəbin dəlillərə dayanan heç bir kökü yoxdur. Batil bir cədvəl hazırladılar və onu (Cəfər) əs-Sadiqə nisbət etdilər. Ramazan günlərinin sayı və hilalı görmək məsələsində fərqli məzhəblərdə olmaqlarına baxmayaraq şiə alimlərindən, fəqihlərindən və mühəddislərindən hər bir kəs bu xəbəri tənqid edir və onu rəvayət edəni yalanlayırlar.”[1143] Çox maraqlıdır ki, Şeyx əl-Mufid özü gənc yaşlarında bu məsələdə əs-Saduq’un məzhəbi üzərində idi. Şeyxlərindən olan Muhəmməd bin Əhməd bin Davud bin Əli əl-Qummi’yə rəddiyyə vermək üçün və digər şeyxi Cəfər bin Qavləveyh’i müdafiə etmək üçün yazdığı “Luməhul-Burhən” kitabında deyir: “Onun yalan danışdığına və atdığı böhtanın böyüklüyünə dəlalət edən dəlillərdən biri də budur ki, əsrimizin - və bu, h. 363-cü ildir - fəqihləri, raviləri və fəzilətli şəxsləri hər əsrdə sayca az olsalar da bu rəy üzərində icma ediblər, buna etiqad edirlər və bunun səhih olduğuna fətva verirlər… Bunların arasında şeyximiz əş-Şərif Əbu Muhəmməd əl-Hüseyni, şeyximiz əs-Siqa Əbul-Qasim Cəfər bin Muhəmməd bin Qavləveyh, şeyximiz əl-Fəqih Əbu Cəfər Muhəmməd bin Əli bin əl-Hüseyn bin Bəbəveyh, şeyximiz Əbu Abdilləh əl-Hüseyn bin Əli bin əl-Hüseyn və şeyximiz Əbu Muhəmməd Harun bin Musa vardır…”[1144] Gördüyümüz kimi müəyyən bir zaman kəsimində bu rəy şiələr arasında ən məşhur və ən mötəbər rəy hesab olunurdu. əl-Behbudi deyir: “Bu hədislər ikinci əsrin axırlarında məşhurlaşdı və şiələrin bir hissəsi bu hədislərin mütəvatir olduğuna aldanaraq beşinci əsrə qədər, hətta Muhəmməd bin Məsud əl-Ayyəşi (vəfatı h. 320) hilalı görmədən əvvəl oruc tutan və orucunu pozanlara qarşı elmi rəddiyyəsini yazandan sonra belə bu hədislərlə əməl etdilər.”[1145] Şiələrin bu barədəki hədisləri əl-Kafi kimi əsas hədis qaynağı kitablarında keçir. Bu cür yalan, uydurma hədislər şiələrin kitablarında çox olduğu üçün, etibarlı rəvayətlər ilə qarışmış olduğu üçün isnad analizi edərək onları bir-

---

[1143] əl-Mufid, “Cəvabat Əhlil-Musal fil-Adəd var-Ruyə”, səh: 16-17; əl-Mutəmər əl-Aləmi li Əlfiyyəti əş-Şeyx əl-Mufid, 1413

[1144] ət-Tehrani, “əz-Zəriə ilə Təsanif əş-Şiə”, 18/340; Darul-Ədva, Beyrut,

[1145] əl-Behbudi, “Mərifətul-Hədis”, səh: 16-17;

birindən ayırmaq asan deyildir. Hüseyn ər-Radi etiraf edir ki, bu hədisləri "bir-birindən ayırmaq çətindir."[1146] Lakin "çətindir" çox yumşaq deyilmiş bir sözdür. əl-Behbudi misal üçün ramazanda günlərin sayı ilə bağlı təfsilatı, ixtilafları qeyd etdikdən sonra deyir: "Sözü bu məqamda ona görə uzatdıq ki, - mövzunun toxunmadığımız uzun quyruğu var - sizinlə birlikdə aşırı fərdlərin, fiqhi məsələlərdən tək bir məsələdə necə hücum çəkdiklərini öyrənək. Əshabımıza və şeyxlərimizə haraya ayaq basdıqları gizli qalmışdı. Aşırılara bu qədər rahatlıqla saxtalaşdırma və hədis uydurma işini həyata keçirməyə imkan verən mühiti etiraf etməyimiz lazımdır, beləki onlardan biri öz şiələri vasitəsi ilə halal və haram mövzularında qırx min hədis uydurmağı və onları hədis kitablarına salmağı bacarmışdır və iki-üç əsr boyunca şeyxlərimiz onların kələklərini görə bilməmişdilər. Beləliklə də araşdırma və analiz əsasında əmin oluruq ki, yalnız isnadların səhihliyinə etibar etmək olmaz, nə də hədislərin bir-birilərinə yaxın ləfzlər ilə mütəvatir olmasına da etibar etmək olmaz. Əksinə həqiqəti mümkün olan hər bir tərəfdən tapmaq, hədisin məşhurluğuna və onunla fətva verənlərin çoxluğuna, kitablarda onları rəvayət edənlərin çoxluğuna aldanmamaq bizə vacibdir."[1147] əl-Behbudinin bu sətrlərdə "sakit şəkildə" ifadə etdiyi fəryad qulaqları deşəcək dərəcədə güclüdür. Hətta şiələrin hədis mirasındakı vəziyyət o qədər ağırdır ki, əl-Behbudi hansısa hədisin məna baxımından mütəvatir dərəcəsinə çatmağını belə hüccət görmür, çünki şiələrin arasında dolaşmış yalançı ravilər elə bir fəsad törədiblər ki, bu fəsadı bu günə qədər aradan qaldırmaq mümkün deyildir.

## Üçüncü misal: Məğrib namazının vaxtı

Daha bir misal burada məğrib namazının girdiyi vaxtla bağlıdır. Bu məsələdə sünnət əhli ittifaq edir və deyir ki, məğrib namazının vaxtı günəş diskinin gözlərdən itməsi ilə başlayır. Şiələrdə isə bu məsələdə ixtilaf vardır; onlardakı bir rəyə görə məğrib

---

[1146] ər-Radi, "əl-Muəməra əl-Kubra alə Mədrasəti Əhl əl-Beyt", səh: 10;

[1147] əl-Behbudi, "Mərifətul-Hədis", səh: 20;

namazının vaxtı şərq səmasındakı qızartının itməsi ilə girir və bu, onlardakı məşhur olan rəydir, ikinci rəy isə əhlüs-sünnətə müvafiq olaraq günəş diskinin gözlərdən itməsi ilə girdiyini deyir. Maraqlıdır ki, birinci rəy əməl olaraq şiələrin arasında yayğın olsa da erkən dönəmi təmsil edən şiə alimləri əhlüs-sünnətə müvafiq olublar. İmami şiələri özləri Cəfər əs-Sadiq'dən və nəvəsi Əli ər-Rida'dan rəvayət edirlər ki, şəfəq qızartısı itənə qədər məğrib namazını gecikdirmək sünnətdən deyildir, əksinə o, şiyələrin arasına sızmış aşırı qrupların Kufə əhlinə öyrətdikləri fasid bir rəydir və bunu yalan və böhtan olaraq imamlara nisbət ediblər.

əl-Muhəqqiq əl-Hilli deyir: "Eynilə günəş batdıqda məğrib namazının vaxtı daxil olur… Günəşin batması isə günəş diskinin yox olması ilə baş verir; (digər rəydə isə) deyilir ki, bu, şərqdəki qızartının yox olması ilə baş verir və ən məşhur olan bu rəydir."[1148] əl-Hilli'nin bu sözündən çıxarış edən əş-Şəxuri deyir ki, ikinci rəyi "ən məşhur" adlandırması birinci rəyin "məşhur" olması deməkdir; beləliklə də birinci rəy məşhur, ikinci rəy isə ən məşhurdur. əl-Muhəqqiq əl-Hilli özü birinci rəydədir. Əslində burada maraqlı olan tərəf budur ki, əhlüs-sünnətə müvafiq olan rəy şiələrdə də hicri yeddinci əsrə qədər alimlər arasında məşhur rəy idi; İbn Əbi Aqil əl-Umməni, İbnul-Cuneyd, İbn Bəbəveyh əl-Qummi, əş-Şərif əl-Murtəda, Səllər əd-Deyləmi, Şeyxut-Taifə ət-Tusi, əl-Muhəqqiq əl-Hilli kimi tanınmış şiə alimləri bu məsələdə əhlüs-sünnətə müvafiq olublar. Həmçinin Həsən bin Zeynuddin əl-Amili, Muhəmməd Baqir əl-Vahid əl-Bəhbəhəni, Əhməd ən-Nəraqi, atası Muhəmməd Mehdi ən-Nəraqi, əl-Muqaddəs əl-Ərdəbili, Şeyx əl-Bəhəi, əl-Feyd əl-Kəşəni, Əbul-Qasim əl-Xoyi və başqaları da bu rəyi müdafiə ediblər.[1149] əl-Xoyi deyir: "Bu məsələdə üç rəy mövcuddur: Birinci: Günəşin batması onun diskinin gözdən itməsi və üfüq altında gizlənməsi ilə tamamlanır. Bu rəyə bir çox görkəmli alimlər tərəfdar olmuşdur. "əl-Mədarik" kitabında açıq şəkildə bu rəyə əsasən fətva verilmişdir… İkinci: Günəşin batması şərq qızartısının başın üstündən tamamilə çəkilməsi ilə tamamlanır. Bu rəyə görə, günəşin üfüqdə gözdən itməsi kifayət deyil. Şərqdə görünən qızartının başın üstündən tam çəkilməsi gözlənilməlidir. Bu, ən məşhur rəy hesab edilir və alimlərin əksəriyyəti bunu qəbul etmişdir. Üçüncü: Günəşin batmasının təsdiqi şərq qızartısının fələkin dörddə birindən

[1148] əl-Hilli, "Şəraiul-İsləm", 1/47;

[1149] Bax: ən-Nəraqi, "Mustənəduş-Şiə", 4/25; əl-Bəhbəhəni, "Məsabihuz-Zaləm", 5/487-488;

tam yox olması ilə müəyyən edilir. Bu, şərq nöqtəsindən başlayaraq günorta xəttinə (cənubdan şimala qədər tam olaraq) yayılan qızartının tamamilə itməsinə əsaslanır. Bu, başın üstündən qızartının itməsindən bir neçə dəqiqə daha gec tamamlanır. Bu rəyə açıq şəkildə tərəfdar olan alimlər çox azdır. Hətta bu görüşü açıq şəkildə müdafiə edən bir alim tapmaq çətindir. Beləliklə, məşhur və əsasən mübahisə edilən yalnız ilk iki rəy olmuşdur." Bunları qeyd etdikdən sonra əl-Xoyi deyir: "Vəziyyət necə olursa-olsun, artıq bilmiş oldun ki, ixtilafın səbəbi bu mövzuda nəql olunan rəvayətlərin fərqli olmasıdır. Buna görə də, bu rəvayətləri qeyd etmək və onları araşdırmaq lazımdır ki, məsələ aydın olsun. İnşallah, biləcəksən ki, daha güclü olan rəy birinci rəydir. İndi isə ikinci rəyə dəlil olaraq gətirilən rəvayətlərə baxmaq lazımdır. Onlar çox olsa da, onlardan heç biri onların iddia etdikləri mənaya açıq şəkildə dəlalət etmir, ya sənəd baxımından zəifdir, ya da məna baxımından dəlil olmağa qadir deyil."[1150] İkinci rəyin dəlillərinin tutarlı olmadığını başqa şiə alimləri də deyiblər. Şeyx Bəhəuddin əl-Amili əl-Bəhəi (h. 953-1030) deyir: "Əshab arasında, xüsusilə də son dönəm alimlər arasında məşhur olan odur ki, məğrib namazının vaxtı şərqdəki qızartının itməsinə bağlıdır. Şeyx Tusi "ət-Təhzib" və "ən-Nihayə" əsərlərində bu rəyi qəbul edib. Lakin bu barədə tam etimad edilə biləcək bir hədisə rast gəlməmişəm."[1151] əl-Xoyi'nin sözünə qayıtmalı olsaq görərik ki, o, daha sonra ikinci rəyə dəlalət edən hədisləri bir-bir qeyd edir və onların zəifliyini və dəlalət baxımından qüsurlu olduğunu göstərir. Daha sonra isə birinci rəyi dəstəkləyən xəbərləri qeyd edir. Şiələrdəki hədis kitablarında keçən rəvayətlərə baxdıqda görürük ki, onlar birinci rəyi çox aşkar şəkildə dəstəkləyir.

ət-Tusi isnadı ilə rəvayət edir ki, İmam Rida deyib: "Əbul-Xattab Kufə əhalisinin böyük əksəriyyətini azdırmışdı. Onlar məğrib namazını qılmaqda şəfəq itənə qədər gözləyirdilər. Halbuki bu, yalnız səfərdə olan, qorxu içində olan və ya xüsusi bir ehtiyacı olan şəxslər üçün olub."[1152] Belə görünür ki, məğrib namazını ilk vaxtından sonra gecikdirmək əslən kufəli ğulat rafizilərdən qalma bir adətdir. əs-Saduq deyir ki, İmam Cəfər əs-Sadiq deyib: "Fəzilətini tələb edərək məğribi gecikdirən lənətlənmişdir, lənətlənmişdir…"[1153] İmamın bu şəkildə lənətləməsi onu göstərir ki, onun dövründə özünü imama nisbət edən

---

[1150] əl-Xoyi, "əl-Mustənədu fi Şərh əl-Urvatil-Vusqa", 11/168-169;

[1151] əl-Bəhəi, "əl-Həblul-Mətin", səh: 142;

[1152] ət-Tusi, "Təhzibul-Əhkəm", 2/33;

[1153] əs-Saduq, "Mən lə Yəhduruhu əl-Fəqih", 1/220;

şiələr arasında bu əməl olub və imamlar bu əməli inkar ediblər, bunu dinə bir bidət olaraq daxil edildiyini deyiblər. Bir başqa rəvayətdə İmam Cəfər deyir: “Ey Carud! Onlara nəsihət edilir, amma qəbul etmirlər. Əgər bir şey eşitsələr, dərhal onu yayarlar; əgər onlara bir xəbər verilsə, dərhal onu ifşa edərlər! Mən onlara dedim ki, məğrib namazını bir az gecikdirin, lakin onlar onu ulduzlar parlayana qədər tərk etdilər. İndi isə mən məğrib namazını günəşin diski batar-batmaz qılıram.”[1154] Bir başqa rəvayətdə Əbu Üsamə Zeyd əş-Şəhhəm belə nəql edir: "Bir dəfə Əbu Qubeys dağına qalxdım, insanlar məğrib namazı qılırdılar. Lakin mən günəşin hələ batmadığını gördüm; sadəcə olaraq, o, dağın arxasında insanlardan gizlənmişdi. Sonra İmam Əbu Abdullah - əleyhissalam - ilə qarşılaşdım və ona bunu xəbər verdim. O mənə dedi: 'Niyə belə etdin? Bu, pis bir iş oldu! Məğrib namazını günəşin dağın arxasında görünmədiyi, tamamilə batdığı və ya üfüqdə itdiyi vaxt qılmalısan. Günəşin qarşısını örtən bir buludun və ya qaranlığın olması halı istisnadır.. Sənin üçün ölçü olan şərq və qərb olmalıdır. İnsanların bunu araşdırıb yoxlamaqları vacib deyildir.”[1155] Bir başqa rəvayətdə Cəfər əs-Sadiq’dən məğrib namazının vaxtı haqqında soruşurlar və o deyir: “Günəşin kürsüsü gözdən itərsə.” Dedim: “Onun kürsüsü nədir?” Dedi: “Onun diski.” Dedim: “Bəs onun diski nə zaman batır?” Dedi: “Ona baxarkən onu görmədiyində.”[1156] Zurara’nın rəvayətində isə İmam Muhəmməd əl-Baqir belə deyib: “Məğrib namazının vaxtı günəşin diski batdıqda daxil olur. Əgər bundan sonra günəşi gördünsə və artıq namaz qılmısansa, namazı təkrar et. Orucun isə keçərlidir; əgər artıq nəsə yemisənsə yeməyin qalanından əl çək!”[1157] Bu rəvayətdən də çox aşkar şəkildə görünür ki, imam günəşin diskinin itməsi ilə namazın vaxtının başladığını öyrədir, çünki əgər günəşin diskinin itməsi ilə şərqdəki şəfəqin itməsini qəsd etmiş olsaydı o zaman diskin yenidən görülməsi ehtimalına yer qalmazdı. Bir digər rəvayətdə Səməa bin Mehran deyir: “Mən Əbu Abdilləhə - aleyhissələm - dedim: "Məğrib namazı haqqında: Bəzən biz namaz qılırıq və qorxuruq ki, günəş hələ də dağın arxasında olsun və ya dağ bizi ondan örtmüş olsun." O

[1154] ət-Tusi, “Təhzibul-Əhkəm”, 2/259;

[1155] əs-Saduq, “Mən lə Yəhduruhu əl-Fəqih”, 1/220-221;

[1156] ət-Tusi, “Təhzibul-Əhkəm”, 2/27-28; “əl-İstibsar”, 1/262; Bu kitablarda hədisin ravisi naməlumdur. Lakin əs-Saduq’un “əl-Əməli” kitabında (səh: 139) bunu Davud bin Fərqad vasitəsi ilə atasından, o da İmamdan rəvayət edir. İsnadının səhih olduğu deyilib.

[1157] əl-Kuleyni, “əl-Kəfi”, 3/279; əl-Xoyi deyir ki, səhihdir. (əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa, 11/181)

buyurdu: "Dağa çıxmağın vacib deyil."[1158] Bu rəvayət də onu göstərir ki, İmam Cəfər əs-Sadiq insanların məğrib namazını günəşin gözlərdən itdiyi vaxtda qılınmasının tərəfdarı olub və günəşin həqiqətən də batıb batmadığını yoxlamaq üçün dağın başına çıxmağı doğru hesab etməyib. Çünki məlumdur ki, yüksəkliyə qalxdıqda üfüqün ötəsini görmüş olursan və dağın başında olan üçün günəş dağın ətəyində olanlara nisbətdə daha gec batır. Məğrib namazının vaxtının girməsini mücərrəd olaraq günəşin diskinin üfüqdə itməsi ilə baş verdiyini deyən rəvayətlər çoxdur. Əbu Usamə əş-Şəhhəm deyir: "Bir kişi Əbu Abdilləhə dedi: "Məğrib namazını ulduzlar tam görünənə qədər gecikdirim?" O buyurdu: "Sən Xəttabiyə firqəsindənmisən?! Cəbrayıl - aleyhissəlam - onu (məğrib namazını) Muhəmmədə - salləllahu aleyhi və alih - günəşin diski batdığı anda nazil etmişdir."[1159] Amr bin Əbi Nasr isə deyir: "Mən Əbu Abdilləhi - aleyhissələm - məğribin vaxtı barəsində belə deyərkən eşitdim: "Günəşin diski (gözlərdən) gizləndisə namazın vaxtı girər və iftar edilər." Bir başqa rəvayətdə Safvan bin Mehran əl-Cəmməl deyir: "Əbu Abdilləhə dedim: Mənimlə birlikdə hər tərəfə səpələnmiş heyvanlarım var, (onların itməsindən qorxduğum üçün) buna görə də məğrib namazını qırmızı şəfəq itənə qədər gecikdirib, sonra isə onu işa namazı ilə birlikdə qılsam bu mənim üçün daha rahat olmazmı?!" O buyurdu: "Günəşin diski batdıqda məğrib namazını qıl. Sən də, malın da yalnız Allah üçündür."[1160] Abdullah bin Sinan deyir: "Əbu Abdilləhi - aleyhissələm - belə deyərkən eşitdim: "Məğribin vaxtı günəş batdıqda, günəşin diski gözdən ittikdə başlayır."[1161] Bəkr bin Muhəmməd əl-Əzdi deyir: "Sonra ondan (yəni İmam əs-Sadiqdən) məğrib namazının vaxtı haqqında soruşdum." Dedi: "Günəşin diski itdikdə."[1162] Bir başqa rəvayətdə İmam Cəfər əs-Sadiq deyir: "Rəsulullah - salləllahu aleyhi və alih - məğrib namazını qılardı və onunla birlikdə Bənu Sələmə adı ilə tanınan Ənsardan olan bir qəbilə də namaz qılardı. Onların evləri məsciddən yarım mil məsafədə yerləşirdi. Onlar Peyğəmbərlə namaz qılıb evlərinə

---

[1158] əs-Saduq, "Mən lə Yəhduruhu əl-Fəqih", 1/218; ət-Tusi, "Təhzibul-Əhkəm", 2/29; Xoyi rəvayətin muvassəq olduğunu deyir. (əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa, 11/182)

[1159] ət-Tusi, "Təhzibul-Əhkəm", 2/28;

[1160] əl-Himyəri, "Qurbul-İsnəd", səh: 29; əl-Xoyi isnadının səhih olduğunu deyir. (əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa", 11/182)

[1161] ət-Tusi, "Təhzibul-Əhkəm", 2/28; əl-Kuleyni, "əl-Kəfi", 3/279-280; əl-Məclisi "Mirətul-Uqul" kitabında (15/40) isnadının səhih olduğunu deyir.

[1162] əl-Himyəri, "Qurbul-İsnəd", səh: 37;

qayıtdıqda, hələ də oxlarının düşdüyü yerləri görə bilirdilər."[1163] Yarım mil bizim müasir ölçü ilə bir kilometrə yaxın məsafədir. Azan verildikdən sonra Peyğəmbərlə - aleyhissalətu vassələm - namaz qıldıqlarını, daha sonra məsciddən ayrılıb evlərinə qayıtdıqlarında hələ də havanın işıqlı olduğunu hesaba alsaq mütləq deməliyik ki, məğrib namazının başlanğıcı günəş diskinin itməsi ilə bağlıdır. Çünki normal sürətlə yürüdükdə o məsafəni təxminən 15-dəqiqəyə qət etmək olur və namazın da bir o qədər çəkdiyini düşünsək, məğrib namazının şərqdəki qızartının itməsi ilə başladığını demək üçün əlimizdə heç bir əsas qalmır. Bir başqa rəvayətdə İmam Cəfər əs-Sadiq deyir: "Allahın elçisi - salləllahu aleyhi va əlihi - məğrib namazını günəş itdiyi zaman, onun qaşı yoxa çıxdıqda qılardı."[1164] Bu rəvayət də aşkar şəkildə dəlalət edir ki, burada etibara alınan günəşin diskinin qıraqlarının gözdən itməsidir, yəni günəşin qaşının yoxa çıxması ilə məğrib namazının vaxtı başlayır. əl-Xoyi deyir ki, "Bu, (günəşin) mücərrəd olaraq batması ilə vaxtın girməsinə dəlalət etmək baxımından babdakı rəvayətlər arasında ən aşkar olanıdır, çünki burada "qaş" sözünün istifadə olunması günəş diskinin batarkən axırının ona bənzəməsinə görədir."[1165] Yezid bin Xəlifə'nin rəvayətində isə onun Cəfər əs-Sadiq'ə belə dediyi keçməkdədir: "Ömər ibn Hənzələ bizə sənin tərəfindən bir vaxt barədə xəbər gətirdi. Əbu Abdullah buyurdu: "O halda adımızdan yalan danışmaz." Mən dedim: "O, deyir ki, məğrib namazının vaxtı günəşin diski batdıqda daxil olur. Lakin Rəsulullah - salləllahu aleyhi və alih - səfərdə tələsdikdə, məğrib namazını gecikdirər və onu işa namazı ilə birləşdirərdi." Dedi: "Doğru deyib."[1166] Ubeyd bin Zurara isə deyir ki, İmam Cəfər əs-Sadiqi belə deyərkən eşidib: "Bir nəfər mənə səfər yoldaşı oldu. O, məğrib namazını gecikdirərək qılar, sübh namazını isə tam qaranlıq ikən qılardı. Lakin mən məğrib namazını günəş batdıqda, sübh namazını isə sübhün girdiyi mənə aydın şəkildə göründükdə qılırdım. O mənə dedi: "Sənə nə mane olur ki, mənim etdiyim kimi edəsən? Axı günəş bizdən əvvəl başqaları üzərində doğur, bizim gözümüzdən itdikdə başqalarına hələ də görünür" Mən dedim: "Bizə vacib olan, günəş bizim üçün batdığı zaman məğrib namazını qılmaq və fəcrin girdiyi bizə açıq-aşkar göründükdə sübh namazını qılmaqdir.

---

[1163] əs-Saduq, "Mən Lə Yəhduruhul-Fəqih", 1/220

[1164] ət-Tusi, "Təhzibul-Əhkəm", 2/258;

[1165] əl-Xoyi, "əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa", 11/181; rəvayətin səhih olduğunu deyir.

[1166] əl-Kuleyni, "əl-Kəfi", 3/279;

Bizə bundan başqa bir şey vacib deyildir. Onlara isə (məğribi) günəş onlar üçün batdıqda qılmaq vacibdir."[1167]

Belə görünür ki, hələ o dövrdə belə kufəli şiələr arasında məğrib namazının vaxtı barəsində şübhələr və tərəddüd var idi. Əbu Yezid Fərqad'ın imama verdiyi sualdan başa düşülür ki, o zaman günəşin batması ilə bağlı şiələrdə problemlər olub. Ona görə də Rza bin Muhəmməd əl-Həmədəni (h. 1322) bu hədislə bağlı deyir: "Onun "günəşin diski nə vaxt batar?" sualını verməsi göstərir ki, belə bir ifadə onlarda tərəddüd doğuran məqamlardan biri idi.[1168] Bir başqa rəvayətdə keçir ki, Əbən bin Təğləb, ər-Rabi bin Süleyman, Əbən bin Ərqam və başqaları dedilər: "Məkkədən yola çıxmışdıq, əl-Əxdar vadisinə çatdığımızda günəşin şüalarını gördüyümüz bir zamanda bir kişinin namaz qıldığını gördük. Bununla bağlı nəfsimizdə bir şey hiss etdik və ona bəd-dua etməyə başladıq Hətta bir rükət namaz qılıb bitirənə qədər biz ona qarşı bəd-dua etdik və deyirdik: "Bu, Mədinə əhlinin gənclərindən biridir." Lakin ona yaxınlaşdığımızda onun Əbu Abdullah Cəfər ibn Məhəmməd - əleyhissəlam - olduğunu gördük. Biz endik və onunla birlikdə namaz qıldıq, lakin bir rükəti qaçırmışdıq. Onu qəza etdikdən sonra ona yaxınlaşdıq və dedik: "Sənə fəda olaq, bu saatda namaz qılırsan?!" O buyurdu: "Günəş batdısa, namazın vaxtı daxil olmuşdur."[1169] Əbul-Qasim əl-Xoyi bu rəvayəti qeyd etdikdən sonra deyir: "Bu, vaxtın başın üstündəki qızartının getməsi ilə müəyyən edilməsinin (o vaxt) imamiyyə şiələri arasında açıq-aydın, bitmiş və onların zehnlərində oturuşmuş bir məsələ olduğunu göstərən ən yaxşı dəlildir. Əks halda, onlar namaz qılan şəxsin əs-Sadiq - əleyhissəlam - olduğunu bilmədən əvvəl onun bu əməlinə necə qəzəblənə bilərdilər?! Beləki onlar dedilər: "nəfsimizdə bir şey hiss etdik," yəni qəzəbləndik."[1170] Aydındır ki, şiələr o zaman günəşin batması ilə məğrib namazını qılmağı sünnilərin məzhəbi olaraq tanıyırdılar və ona müxalif olmağa çalışırdılar. Məhz buna görə onlar ilk baxışda Cəfər əs-Sadiq'in Mədinə əhlindən, yəni sünnət əhlindən olduğunu güman etdilər. Şeyx Rza əl-Həmədəni də bunu təsdiqləyərək deyir: "Bu rəvayətdən aydın olur ki, məğrib namazının vaxtının günəş batdıqdan sonra gecikdirilməsi, onların dövründə də — bu dövrlərdə olduğu kimi — şiələrin zehnində möhkəmlənmiş bir anlayış idi. Belə ki, onlar günəş

[1167] əs-Saduq, "əl-Əməli", səh: 140;

[1168] əl-Həmədni, "Misbəhul-Fəqih", 9/146

[1169] əl-Amili, "Vasəil əş-Şiə", 4/180; "Əməli əs-Saduq", səh: 140-141;

[1170] əl-Xoyi, "əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa", 11/180;

batdıqdan sonra, hələ də şüaların qaldığı halda namaz qılmağı, müxaliflərin (yəni sünnilərin) şüarlarından biri kimi görürdülər."[1171]

Şərqdəki şəfəqin itməyini şərt görən xəbərlərin reallıqla da uyğun olmadığını bəzi şiə alimləri qeyd ediblər və buna işarə ediblər. əl-Muqaddəs əl-Ərdəbili yazır: "... (bu rəvayətlərin) məzmunu da reallıqla ziddiyyət təşkil edir, çünki qızartı başın üstünə çatmır və onu aşmır, əksinə, iki istiqamətdə nizə boyu yüksəlir və irəliləyir, bu da ona diqqət yetirən hər kəsə aydındır."[1172] Əlbəttə ki, bu rəy reallığa müvafiq olmadığı kimi tamamilə başqa səbəblərdən məşhurlaşmışdır. Ən əsas səbəb isə sünnət əhlinə müxalif olmaqdır. əl-Məclisi deyir: "Mötəbər və çoxsaylı rəvayətlər ikinci görüşü, yəni günəş diskisinin (qurs) gözdən itməsini dəstəkləyir. Görünür, əksər alimlər bu rəvayətləri qəbul etməmiş və onlardan dönmüşlər, çünki bu görüş əhli-sünnənin məzhəblərinə uyğun gəlirdi. Buna görə də, onlar bu rəvayətləri təqiyyə üzərinə yozmuşlar."[1173] Məğribin vaxtının günəşin diskinin batması ilə girdiyini deyən rəyə dəlalət edən rəvayətləri şiə alimi əl-Feyd əl-Kəşəni "mötəbər mustəfid" olaraq vəsf edir və müxalif rəyə dəlalət edən rəvayətlərin "zəif, etibara müxalif və təvil oluna biləcək" növdən olduğunu deyir.[1174] Məlumdur ki, mustəfid həddi mütəvatirə yaxın bir dərəcədir. Bunun eynisini əl-Bəhbəhəni də deyir. Muhəmməd Həsən ən-Nəcəfi deyir ki, "bu naslar həddindən artıq müstəfid dərəcəsindədir, içində səhih və başqaları var, hətta mütəvatir olduğu iddia oluna bilər."[1175]

## Dördüncü misal: Azanın sözləri

Misallardan biri də azanda "əşhədu ənnə əmiral-mumininə aliyyən valiyyullah" sözlərini əlavə etməkdir. Bu məsələdə danışmış və məsələ haqqında hökm bəyan etmiş ilk şiə alimi

[1171] əl-Həmədəni, "Misbahul-Fəqih", 9/147;
[1172] əl-Ərdəbili, "Məcmə əl-Faidə val-Burhən", 2/24;
[1173] əl-Məclisi, "Bihər əl-Ənvar", 80/51;
[1174] əl-Kəşəni, "Məfətih əş-Şərai", 1/94;
[1175] ən-Nəcəsi, "Cəvahirul-Kələm", 7/180;

Şeyx əs-Saduq olub: "Doğru azan budur – nə bir şey artırılır, nə də əskildilir. Mufəvvida - Allah onları lənətləsin! - bəzi xəbərlər uydurmuş və azana iki dəfə "Muhəmməd və Ali-Muhəmməd xeyrul-bəriyyədir" sözlərini, və bəzi rəvayətlərində isə "Əşhədu ənnə Muhəmmədən Rasullullah" cümləsindən sonra iki dəfə "Əşhədu ənnə Əliyyən Vəliyyullah" sözlərini əlavə ediblər. Onlardan bəziləri isə bu cümlənin yerinə iki dəfə "Əşhədu ənnə Əliyyən Əmirul-Mu'mininə haqqan" deməyi rəvayət ediblər. Əlinin Allah vəlisi olmasında və onun həqiqətən möminlərin əmiri olmasında və Muhəmməd və onun Əhli-Beytinin – Allahın onlara salavatı olsun – yaradılmışların ən xeyirlisi olmaqlarında şəkk yoxdur. Lakin bunlar azanın əslində yoxdur. Mən bunu yalnız bu əlavələr vasitəsilə mufəvvida firqəsinə mənsub olanların, yəni özlərini bizim cərgəmizdə gizlədənlərin tanınması üçün qeyd etdim."[1176] Bu çox önəmli bir şahidlikdir, çünki ağlı səlim və təsəvvürü normal olan hər bir kəs bilir ki, Allahın elçisinin - aleyhissalətu vassələm - zamanında azanlarda bu əlavə sözlər olmayıb. Xəlifələrin zamanında da azanlarda bu sözlər oxudulmayıb. Bunun sonradan uydurulmuş bir bidət olduğu aşkar bir məsələdir. Xüsusilə də əs-Saduq kimi tanınmış bir şiə aliminin konkret olaraq bu sözləri azana əlavə edənlərin aşırı şiə qruplar olduğunu deməsi çox əhəmiyyətlidir.

Lakin əs-Saduq'un dövründən sonra bu məsələdə şiə alimləri qəribə bir yanaşma ortaya qoymağa başladılar. əl-Mufid, İbnul-Cuneyd və əl-Umməni kimi erkən dönəm şiə fəqihlər bu məsələdə azanda üçüncü şəhadəti nəql etməyiblər, kitablarında və fətvalarında belə bir şey öyrətməyiblər. əl-Mufid israr ilə əhlüs-sünnətə müxalif olaraq azanda "hayyə alə xayril-aməl" sözlərinin olduğunu isbat etməyə çalışmasına baxmayaraq üçüncü şəhadət barəsində heç bir şey demir. Həmçinin əş-Şərif əl-Murtəda (h. 355-436) da bu barədə bir söz demir. Onun tələbələri təbəqəsindəki Əbus-Saləh əl-Hələbi (h. 374-447), Əbu Yalə Həmzə əd-Deyləmi (h. 448), İbnul-Bərrac ət-Tarablusi (h. 400-481) və Salman bin əl-Həsən əs-Sahraşti kimi şiə alimləri azan və iqamə haqqında danışsalar da üçüncü şəhadətin bura daxil olduğunu deməyiblər. Bu barədə açıq şəkildə danışan ikinci şiə alimi Şeyxut-Taifə ət-Tusi (h. 385-460) olub; beləki "ən-Nihəyə" kitabında deyir: "Amma şazz xəbərlərdə rəvayət olunmuş "əşhədu ənnə aliyyən valiyyullah va ali muhəmməd xayrul-bəriyyə" sözlərinə gəldikdə isə, bunlar azan və iqamədə əməl olunacaq şey deyil. Hər kim bunlarla əməl edərsə xətaya

[1176] əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", 1/290-291;

yol vermiş olar."[1177] Bu sözlər də əs-Saduq'un dediklərinə müvafiqdir, çünki bu barədə gəlmiş xəbərlərin səhih olmadığını, əksinə şazz olduğunu bəyan edir və bu xəbərlərlə əməl edənin xətakar olduğunu təsdiqləyir. Lakin "əl-Məbsut" kitabında ət-Tusi'nin mövqeyində dəyişiklik görürük, beləki "əl-Məbsut" kitabında yazır: "Amma şazz xəbərlərdə gəldiyinə əsasən 'Əşhədu ənnə Əliyyən Əmirul-mu'minīn' və 'Ali-Muhəmməd xeyrul-bəriyyədir' deməyinə gəlincə azanda bununla əməl edilmir. Əgər bir şəxs bunu etsə, günah qazanmır, lakin bu, nə azanın fəzilətlərindəndir, nə də onun fəsillərinin kamilliyindəndir."[1178] Artıq burada bir yumşalma görürük, beləki azanda bu sözləri oxuyanın günah qazanmadığını deyir. "Günah qazanmadığını" yazmasından başa düşürük ki, onun nəzərində bu, məkruh hökmündədir, əgər sadəcə olaraq caiz hesab etsəydi bu cür "günah qazanmır" yazmazdı, bir başa icazəli olduğunu deyərdi.

ət-Tusi'dən sonrakı dönəmi təmsil edən şiə fəqihlərinə gəldikdə isə İbn Zəhra əl-Hələbi (h. 511-585), əl-Fədl bin əl-Həsən ət-Tabrasi (vəf. h. 548), İbn İdris əl-Hələbi (vəf. h. 598), İbn Həmzə Muhəmməd bin Əli ət-Tusi (vəfatı təxminən h. 585), İbn Əbil-Məcd əl-Hələbi (hicri altıncı əsr), əl-Muhəqqiq Nəcmuddin əl-Hilli (h. 602-676), hicri yeddinci əsrin alimlərindən əl-Fadil ləqəbli əl-Muhəqqiq əl-Əbi, əl-Alləmə əl-Hilli'nin oğlu Fəxrul-Muhəqqiqin ləqəbli Muhəmməd bin əl-Həsən bin Yusuf əl-Hilli (h. 682-771) kimi şiə alimləri azan və iqamə babında üçüncü şəhadət barəsində ümumiyyətlə danışmırlar, azanın doğru şəklini şiə məzhəbinə görə qeyd edirlər və ora üçüncü şəhadəti daxil etmirlər. Bu təbəqədə bəzi istisnalar var. Yəhya bin Said əl-Hilli (h. 601-690) "əl-Cami liş-Şərai" kitabında qısaca olaraq bunu deyir: "Şazz xəbərlərdə rəvayət olunmuş "Əli valiyullah" və "Al Muhəmməd Xayrul-Bəriyyə" kimi sözlərə gəldikdə isə onlarla əməl olunmaz."[1179] Bu şəkildə qısa olaraq bu barədə gəlmiş xəbərlərin etibarsızlığına diqqət çəkir, lakin bu xəbərlər ilə əməl edənlər barəsində bir hökm vermir. Bu istisnalardan biri də əl-Alləmə İbnul-Mutahhər əl-Hilli'dir. O (h. 648-726) bu barədə birdən çox kitabında danışır. "Muntəhə əl-Mətləb"

---

[1177] ət-Tusi, "ən-Nihəyə", səh: 69;

[1178] ət-Tusi, "əl-Məbsut", 1/99; Əslində "əl-Məktəbə əl-Murtədaviyyə" tərəfindən çap olunmuş bu versiyaya baxdıqda görəcəyik ki, orada göstərdiyimiz səhifədə "əgər bir şəxs bunu etsə günah qazanar" yazılıb, lakin "əl-Məbsut" kitabından bu hissəsini sitat gətirən şiə alimləri yekdilliklə bu hissəni "günah qazanmır" şəklində qeyd edirlər, üstəlik cümlənin forması da buna dəlalət edir.

[1179] əl-Hilli, "əl-Cami liş-Şərai", səh: 73;

kitabında deyir: “Amma şazz rəvayətlərdə nəql olunan 'Əli Allahın vəlisidir' və 'Ali-Muhəmməd xeyrul-bəriyyədir' sözlərinə gəlincə – bunlara etibar edilməz. əş-Şeyx (ət-Tusi) 'əl-Məbsut' əsərində demişdir: “Əgər bunu etsə, günahkar olmaz.” Amma 'ən-Nihayə' əsərində isə belə demişdir: “O, xəta etmiş olar.'"[1180] Bir başqa kitabında eyni sözləri bu şəkildə çatdırır: “əş-Şeyx demişdir: Əgər bir şəxs bu sözlərlə əməl edərsə, günahkar olmaz. Amma şazz xəbərlərdə nəql olunan 'Əli Allahın vəlisidir' və 'Ali-Muhəmməd xeyrul-bəriyyədir' sözlərinə gəlincə bu, azanda əməl ediləcək şeylərdən deyil. Kim bu sözlərlə (azanda) əməl edərsə, xəta etmiş olar.”[1181] Əksinə əl-Hilli’nin bu iki kitabda dedikləri elə Şeyx ət-Taifə ət-Tusi’nin iki fərqli kitabda dedikləri sözlərin bir arada təqdim edilmiş formasıdır. “Nihəyətul-Əhkam” kitabında isə azanın doğru şəklini nəql etdikdən sonra deyir ki, “azanın vəsfi ilə bağlı bizim dediklərimizin nəqli əhlul-beytdən - aleyhimussələm - mütəvatirdir və onlar ibadətlərin keyfiyyətini hamıdan yaxşı bilirlər.” Daha sonra buyurur: “Azanın fəsillərində “Əliyyən Vəliyyullah” və “Ali Muhəmməd Xayrul-Bəriyyə” demək məşruiyyəti olmadığı üçün caiz deyildir.”[1182] Bu sözlərin zahiri budur ki, azanda bu sözləri demək haramdır, çünki caiz fəqihlərin terminologiyasında məkruhu da öz tərkibinə alır. Onu da əlavə etməliyik ki, əl-Muhəqqiq Nəcmuddin əl-Hilli “əl-Mutəbər” kitabında azanın doğru şəklini qeyd etdikdən sonra əlavə edir ki, “bundan əlavə deyilənlər isə bidətdir.”[1183] Bir şeyə bu cür mütləq olaraq bidət demək bu sözləri deməyin caiz olmadığını ifadə edir. Səkkizinci əsrin şiə fəqihlərindən əş-Şəhid əl-Əvvəl ləqəbli Muhəmməd bin Məkki əl-Cizini’nin (h. 734-786) dedikləri də əl-Allamə əl-Hilli’nin dediklərinə müvafiqdir. O bir kitabında buyurur: “**Dördüncü məsələ: Azanda "Əli Allahın vəlisidir" və "Ali-Muhəmməd xeyrul-bəriyyədir" sözlərinin nadir xəbərlərdə nəql olunması. əş-**Şeyx demişdir: Amma şazz xəbərlərdə rəvayət olunan "Əli Allahın vəlisidir" və "Ali-Muhəmməd xeyrul-bəriyyədir" sözlərinə gəlincə bunlarla azanda əməl edilməz. Kim (azanda) bununla əməl edərsə, xəta etmişdir. "**əl-Məbsut**" adlı əsərində deyir:” Əgər bir şəxs bunu etsə, günah etmiş olmaz. **İbn Babəveyh** isə belə demişdir: “Mufəvvidə azan haqqında uydurduqları bəzi xəbərlər rəvayət ediblər: "Muhəmməd va Ali-Muhəmməd xayrul-bəriyyə və əşhədu ənnə Aliyyən

---

[1180] əl-Hilli, “Muntəhə əl-Mətləb”, 4/381;
[1181] əl-Hilli, “Təzkiratul-Fuqahə”, 3/45;
[1182] əl-Hilli, “Nihəyətul-Əhkəm”, 1/412;
[1183] əl-Hilli, “əl-Mutəbər fi Şərh əl-Muxtəsar”, 2/141;

valiyullah" və "(Əli) əmirul-muminin haqqan haqqan!" Əlinin Allahın vəlisi olması və Muhəmmədin ailəsinin bəşərin ən xeyirliləri olmasında şəkk yoxdur, lakin bu sözlər azanın əslindən deyil." Dedi: "Bunu yalnız ona görə qeyd etdim ki, bu əlavələri (uydurmaqda) ittiham olunanlar və özlərini bizim cərgəmizə qatan kəslər tanınsınlar."[1184] "əl-Bəyan" kitabında da ət-Tusi'nin "əl-Məbsut" kitabındakı sözlərini nəql etməklə kifayətlənir, öz rəyini xüsusi bir şəkildə ifadə etmir.[1185] "əd-Durus" kitabında isə əş-Şəhid əl-Əvvəl bu sözləri deyir: "Əlinin – aleyhissəlam – vilayətinə dair və Mühəmmədin və onun Əhli-Beytinin bəşərin ən xeyirliləri olduğuna dair şəhadət gətirməyə gəldikdə isə, bunlar **imanın əhkamındandır**, **azanın sözlərindən deyil**. (əş-Şeyx ət-Tusi) "*ən-Nihayə*" əsərində bu sözləri deyənin xəta etdiyinə qəti qərar verir. **İbn Babəveyh** bunları mufəvvidaların uydurulmalarına nisbət edib. "**əl-Məbsut**" əsərində isə (ət-Tusi) deyir ki, "bununla **günah qazanmır**."."[1186] "əl-Lumətud-Diməşqiyyə" kitabında isə yazır: "Azanda və iqamədə bundan başqa - misal üçün (Əlinin) vilayət(i) və "Muhəmməd va ailəsinin ən xeyirli yaradılmışlar olması" kimi - (fəsl)lərin məşruiyyətinə etiqad etmək caiz deyildir, baxmayaraq ki, həqiqətdə onlar elədirlər." Yəni həqiqətdə Əli Allahın vəlisi və əhlul-beyt yaradılmışların ən xeyirlisi olsa da bu sözlərin azanın bir hissəsi olduğuna etiqad etmək caiz deyildir. Lakin onun öz sözlərindən, bu əlavə sözləri azana daxil edib oxuyan kəsin hökmü ilə bağlı hökm çıxarmaq olmur. Əgər ət-Tusi və İbn Babəveyh'in sözlərini nəql etməsini bununla razılaşmaq kimi başa düşsək çıxaracağımız nəticə bu olacaq ki, bu sözlər aşırı şiələr tərəfindən uydurularaq azana əlavə edilib, bunu azanda oxuyan xəta edir, amma günah qazanmır. Başqa cür desək bunun məkruh olduğuna hökm edir. Amma bu sözlərin azanın bir hissəsi olduğuna etiqad etməyi isə konkret olaraq haram hesab edir. Hicri doqquzuncu əsrə nəzər saldığımızda görürük ki, İbn Fəhd əl-Hilli (h. 757-841), əl-Miqdad əs-Suyuri (vəf. h. 826) və Şəmsuddin Muhəmməd bin Şucə əl-Qattan əl-Hilli (h. 832-ci ildə sağ idi) kimi şiə alimləri azanın və iqamənin sözlərini kitablarında zikr edirlər, lakin üçüncü şəhadət məsələsinə toxunmurlar, yəni azanda Əlinin vilayətinə şahidlik etməyin hökmü, bunu edənin hökmü ilə bağlı bir söz söyləmirlər.

---

[1184] əş-Şəhid əl-Əvvəl, "Zikra əş-Şiə", 3/202-203;

[1185] Bax: "əl-Bəyan", səh: 73;

[1186] əş-Şəhid əl-Əvval, "əd-Durus əş-Şəriyyə", 1/162

Lakin onuncu əsrə daxil olduğumuzda aşkar bir fərq görməyə başlayırıq. Beləki, bu dönəmdə tarix səhnəsinə Səfəvi dövləti çıxır və dinə bəzi bidətlər əlavə edir. Əlavə etdikləri bidətlərdən biri də azanda üçüncü şəhadətin deyilməsi oldu. Şeyx Hüseyn əl-Mudərrisi ət-Tabətabəi[1187] deyir: "Belə görünür ki, Şah İsmayıl əs-Səfəvi (hicri) 907-ci ildə bunu əmr etməyənə qədər[1188] üçüncü şəhadət azanlarda zikr olunmurdu. Azana bu sözlər əlavə edildiyi zaman belə deyilirdi ki, bu şəhadət beş əsrdən bəridir ki, tərk olunmuş bir şiə sünnətidir.[1189]

[1187] Hüseyn əl-Mudərrisi ət-Tabətabəi 1952-ci ildə İranın Qum şəhərində anadan olmuşdur. O, Qum hövzəsində ənənəvi dini təhsil almış, burada ərəb dili və ədəbiyyatı, Qurani-Kərim və hədis elmləri, İslam fəlsəfəsi, ilahiyyat və hüquq sahələrində dərslər almışdır. Muhəmməd Fazil əl-Lənkərani, Hüseyn Nuri əl-Həmədani, Yusuf əs-Sanii, Muhəmməd Muhəmmədi əl-Ceylani, Abdullah əl-Cavadi əl-Əmuli, Murtəda əl-Mutəhhəri, Muhəmməd Şah Abadi və başqalarından dərs alıb. Bir il ərzində Muhəmməd əl-Muhəqqiq əd-Damad və on il Murtəda əl-Hairi'nin yanında bəhs-xaric dərsləri alıb. Təhsilini müvəffəqiyyətlə başa vuraraq, İslam hüququnda ən yüksək ixtisas dərəcəsi olan ictihad icazəsi əldə etmişdir. Daha sonra, bir neçə il ərzində Qum hövzəsində müəllimlik etmişdir. əl-Mudərrisi daha sonra təhsilini davam etdirmək üçün Qərbə üz tutmuş və 1982-ci ildə Oksford Universitetində İslam hüququ üzrə fəlsəfə doktoru (D.Phil.) dərəcəsi almışdır. 1983-cü ildən etibarən Prinston Universitetində Yaxın Şərq Araşdırmaları üzrə Bayard Dodc professoru kimi fəaliyyət göstərir. Eyni zamanda, 1988-ci ildən Oksford Universitetinin St. Antony's Kollecində Golestaneh təqaüdçüsü, 1990-cı ildən isə Kolumbiya Universitetinin Beynəlxalq və İctimai Əlaqələr Məktəbində baş tədqiqatçı kimi çalışır. Modarressi, İslam hüququ və şiə doktrinası sahələrində aparıcı tədqiqatçılardan biridir. O, ingilis, ərəb və fars dillərində otuzdan çox kitab və çoxsaylı məqalələrin müəllifidir. Əsas əsərləri arasında "Kharaj in Islamic Law" (1983), "An Introduction to Shi'i Law" (1984), "Crisis and Consolidation in the Formative Period of Shi'ite Islam" (1993) və "Tradition and Survival: A Bibliographical Survey of Early Shi'ite Literature" (2003) kimi nüfuzlu nəşrlər yer alır.

[1188] əl-Mudərrasi burada bir qeyd əlavə edir: "ət-Tənuxi'nin "Nişvarul-Muhədara" kitabında (2/133) Əbul-Fərəc əl-Əsbəhəni'dən nəql etdiyi - "əl-Qat'iyyə şiələrindən bir nəfəri "Allahu Əkbər, Əşhədu əllə iləhə illəllah, Əhşəhu ənnə Muhəmmədən rasulullah, Əşhədu ənnə Aliyyən valiyyullah və Muhəmməd va Ali xayrul-bəşər və bunu deməyən kafirdir" deyərkən eşitdim" - sözlərinə gəldikdə isə aşkarda görünən budur ki, o, bununla mufəvvidalardakı məsləkə işarə etmişdir. əs-Saduq da həmçinin onlara ikinci ibarəni nisbət edir."

[1189] Bu yerdə Şeyx əl-Mudərrasi qaynaq olaraq Həsən Bəy Rumlu'nun "Əhsənüt-Təvarix" kitabına (12/61) istinad edib. Azərbaycan dilindəki nəşrdə Həsən Bəy Rumlu'nun sözləri tam şəkildə belədir: "Həmçinin hakimiyyətinin başlanğıcında (cülusunun əvvəllərində) əmr etdi ki, məmləkətlərin xətibləri on iki imamın – ulu məlik olan Allahın salamı olsun onlara – adına xütbə oxusunlar. 528 il öncə Sultan Toğrul bəy ibn Mikayıl ibn Səlcuqun gəlişindən və Bəsasirinin qaçışından etibarən islam ölkələrində qadağan olunmuş "Əşhədü ənnə Əliyyən-vəliyyullah" ("Şəhadət edirəm ki, Əli Allahın vəlisidir") və "Həyyə əla xeyril-əməl" ("Əməllərin ən yaxşısına – namaza – tələsin!") [ifadələrinin] azana əlavə edilib deyilməsini də əmr etdi. Hökmdar fərman verdi ki, bazarlarda Əbu-Bəkrə, Ömərə və Osmana tənə və lənət edilsin və buna qarşı çıxan hər kəsin başını bədənindən ayırsınlar. O zaman camaatın haqq olan Cəfəri məzhəbinin məsələlərindən və on iki imam ("əimmeyi-isna-əşəri") tərəfdarlarının qayda-qanunlarından məlumatı yox idi. Çünki imamiyyə fiqhinin kitablarından ortada bir şey yox idi. Ona görə də dərin bilikli alimlərin sultanı Şeyx Cəmaləddin Mütəhhər Hillinin

Bunun üstündən bir əsr keçdikdən sonra bu şəhadət azanlarda o dərəcədə yayğınlaşdı ki, onu deməkdən imtina edənlər sünni olmaqda ittiham olunurdu; hətta fiqhi baxımdan buna etiraz edən fəqihlər belə avam kütlənin onların bu etirazını yalnış başa düşə biləcəklərindən qorxduqları üçün susmağa və təqiyyə etməyə üstünlük verdilər."[1190] Beləliklə də səfəvi dövlətində azan rəsmi olaraq dəyişdirildi və azana keçmişdə aşırı şiələrin bidəti və şüarı hesab olunan sözlər əlavə edildi. Ona görə də artıq onuncu əsrdən başlayaraq şiə alimlərinin kitablarında tamamilə fərqli bir dəyişiklik müşahidə olunur. Misal üçün əş-Şəhid əs-Səni ləqəbli Zeynuddin əl-Amili (h. 911-965) yuxarıda "əl-Lumətud-Diməşqiyyə" kitabında keçən sözləri şərh edərkən deyir: "Həqiqətdə haqq olan hər şeyi şəri olaraq vəzifələndirilmiş və Allah tərəfindən məhdudlaşdırılmış ibadətlərə daxil etmək icazəli deyildir, çünki bu təqdirdə onu ibadətə daxil etmək bidət və dində yeni bir qanun qoymaq olacaq, bunun misalı namaza bir rükət və ya bir təşəhhüd əlavə etmək kimidir. Yekun olaraq bu kimi şeylər imanın əhkamındandır, azanın fəsillərindən deyildir. əs-Saduq deyib: "Azana bu sözləri daxil etmək mufavvida'nın uydurmasıdır və onlar aşırı qruplardan biridir. Kimsə bu əlavələri və ya onlardan birini azanın tərkib hissəsi olduğuna inanaraq edərsə etiqadında günah etmişdir, onun bu əməli azanı batil etmir. Lakin bu etiqad olmadan edərsə bunda bir sıxıntı yoxdur. "əl-Məbsut" kitabında (Şeyxut-Taifə" mütləq şəkildə günah olmadığını deyib, müəllif də (yəni əş-Şəhid əl-Əvvəl) "əl-Bəyan" kitabında eynisini deyib."[1191] Gördüyümüz kimi buradakı yenilik, bu sözləri azanda onun azanın bir hissəsi olduğuna etiqad etmədən deməyin problemsiz olması hökmü oldu. ət-Tusi daha əvvəl etiqad və ya etiqad olmadan belə bir şey etmək arasında fərq qoymadan mütləq şəkildə bunun günah olmadığını desə də, bunun problemsiz olduğunu demir, çünki günah olmayan hər şey problemsiz deyildir, çünki ət-Tusi'nin digər kitabında bunu etməyin xəta olduğunu dediyinə şahid olduq. Bəlkə də ət-Tusi'nin belə öz zamanında bu cür yumşaq bir mövqe sərgiləməsində onun dönəmindəki siyasi təsirin rolu ola bilərdi, çünki Əbul-Haris Arslan əl-

---

əsərləri cümləsindən olan və şəriətin pənahı Qazı Nəsrulla Zeytuninin {şəxsi kitabxanasına} məxsus olan "Qəvaidi-islam" ("İslam qaydaları") kitabının birinci cildini dini məsələlərin təlimi və öyrədilməsi üçün istifadə etdilər. Nəhayət, on iki imam (isna-əşəri) məzhəbinin həqiqət günəşi günbəgün yüksəldi, aləmin ətrafı və yanyörəsi onun məşriqindən doğan doğruluq yolunun parlaq şüaları ilə nurlandı. " Bax: Həsən Bəy Rumlu, "Əhsənüt-Təvarix", səh: 375-376; Kastamonu, Uzanlar, 2017

[1190] əl-Mudərrasi, "Tətavvur əl-Məbani əl-Fikriyyə lit-Təşəyyu", səh: 73;

[1191] əl-Amili, "ər-Ravdatul-Bəhiyyə fi Şərh əl-Lumətid-Diməşqiyyə", 1/573;

Bəsasiri hicri 450-ci ildə Bağdad şəhərini ələ keçirdikdə məscidlərdə şiə xütbələri oxutdurmuşdu, hətta Həsəb Bəy Rumlu'nun sözlərindən başa düşülür ki, onun zamanında azanda üçüncü şəhadət oxunurdu. Şeyxut-Taifə ət-Tusi bu zaman Bağdadda yaşayırdı və "əl-Məbsut" kitabını da tam bu ərəfədə yazıb. Belə görünür ki, hər iki şiə aliminin bu məsələyə toxunması və buna yeni bir çalar əlavə etməsi siyasi dəyişikliklərin baş verdiyi ərəfədə olub. Çünki əş-Şəhid əs-Səni digər kitablarında bu məsələdə sərt mövqe tutur. Misal üçün əl-Alləmə əl-Hilli "əs-salətu xayrun minən-nəum" sözünü azana əlavə etməyin məkruh olduğunu dedikdə ona etiraz edərək buyurur: "Doğru olan bunun haram olmasıdır, çünki azan və iqamə digər ibadətlər kimi şəriətdən götürülən iki sünnətdir, beləliklə də onlara nəsə əlavə etmək haram olan təşridir, necəki azana "Muhəmməd və ailəsi yaradılmışların ən xeyirlisidir" sözlərini əlavə etmək də haramdır, baxmayaraq ki, onlar - aleyhimussələm - həqiqətən də yaradılmışların ən xeyirlisidir."[1192] Bu sözlərin zahirindən belə başa düşülür ki, mütləq şəkildə azana bu sözləri əlavə etmək haramdır. "Ravdul-Cənən fi Şərh İrşəd əl-Əzhən" kitabında isə yazır: "(Azana və iqaməyə) "Əliyyən vəliyyullah" və "Ali Muhəmməd Xayrul-Bəriyyə" sözlərini və bənzər sözləri əlavə etməyə gəldikdə isə bidətdir və bu barədəki xəbərlər uydurmadır."[1193] Bu da heç bir təfsilata getmədən konkret bir hökm verir; bu barədəki xəbərlər uydurmadır və bu əməlin özü bidətdir. Bu isə zahirən bunu edənlərin haram etdiyinə dəlalət edir. Görəsən nə üçün "əl-Lum'a" kitabının şərhində təfsilata gedərək bu bidətə imkan yaradacaq bir qeyd əlavə edir. Üstəlik azanda bunu davamlı şəkildə oxuduqda bu artıq azanın bir tərkib hissəsinə çevrilmiş olur, bunun azanın tərkib hissəsi olduğuna etiqad etmədən onun tərkib hissəsi kimi oxumaq necə mümkündür?! Onunla təxminən eyni zamanda yaşamış əl-Muhəqqiq əl-Ərdəbili (vəf. h. 993) yuxarıda Şeyx əs-Saduq'dan nəql etdiyimiz sözləri zikr etdikdən sonra deyir: "Buna tabe olmaq lazımdır, çünki bu haqdır. Buna görə də Peyğəmbərin - salləllahu aleyhi va alih - dövründəki azanda dəyişiklik etdiyinə görə ikinci (xəlifə) tənqid edilir. Elə isə, ona yönəldilən bu tənqid varkən, onun etdiyi kimi bir işi etmək düzgün olmaz."[1194] Belə görünür ki, əl-Ərdəbili öz zamanında səfəvi dövlətinin azanlarda oxutdurduğu bidətə şiələrin yanaşma tərzindəki ikili standartı gördüyü üçün buna qarşı susmamış və buna diqqət çəkmişdir. Çünki

---

[1192] əl-Amili, "Məsəlikul-Əfhəm ilə Tənqih Şərai əl-İsləm", 1/189-190;

[1193] əl-Amili, "Məvsuatuş-Şəhid əs-Səni", 2/235

[1194] əl-Ərdəbili, "Məcmə əl-Fəidə", 2/181;

necə olur ki, şiələr xəlifə Öməri azana "əs-salətu xayrun minən-nəum" (Namaz yatmaqdan xeyirlidir) sözlərini əlavə etməkdə ittiham edib onu azarladıqları halda şiə fəqihlərinin ittifaq ilə bidət olduğunu söylədikləri sözləri özləri azana əlavə edib oxuyurlar?! əl-Ərdəbili'dən bir əsr sonra yaşamış əl-Muhəqqiq Muhəmməd Baqir əs-Səbzəvari (h. 1017-1090) yazır: "Amma "Əli Allahın vəlisidir" və "Məhəmmədin ailəsi bəşərin ən xeyirlisidir" kimi ifadələrin əlavə edilməsinə gəlincə, alimlər bunun bidət olduğunu açıq şəkildə bəyan etmişlər – hərçənd bu sözlər doğrudur və haqdır – çünki söhbət bu sözlərin azana daxil edilməsindən gedir və azana daxil edilməsi isə şəri dəlilə əsaslanmalıdır. Halbuki bu barədə heç bir şəri dəlil sabit olmamışdır."[1195] Səfəvi dövlətində alimlərin hamısı eyni şəkildə cürətli olmayıblar. əl-Mudərrasi yuxarıda ictimai təzyiqdən danışarkən Muhəmməd Təqi əl-Məclisi'nin (h. 1003-1070) fars dilində yazdığı "Ləvami Sahibqurani" kitabına istinad edir. Kitabdakı maraqlı hekayət isə əl-Məclisi ilə şeyxi Abdullah ət-Tustəri arasında baş vermiş bir söhbətdən ibarətdir. Beləki əl-Məclisi ustadı Molla Abdullah ət-Tustəri'nin dərslərinə qatılardı. Söhbət azan və iqamədə üçüncü şəhadət məsələsinə çatdıqda, Molla Abdullah bu mövzuda Şeyx Səduqun sözlərini nəql edir. Bunun üzərinə Muhəmməd Təqi əl-Məclisi ondan soruşur: "Bəs nə üçün sən azan və iqamədə üçüncü şəhadəti deyirsən?" O da cavab verir: "Təyəmmün və təbərrük üçün." Tələbələr ilə züzakirə və fikir mübadiləsindən sonra ustad Abdullah bu şəhadəti azan və iqamədə deməyi tərk etmək qərarına gəlir. Lakin — əl-Məclisi'nin dediyinə görə — çox keçmir ki, Molla Abdullah sünni olmaqda ittiham edilir. əl-Məclisi dərhal ustadının yanına gedərək ona deyir: "Artıq sənə təqiyyə babından üçüncü şəhadəti demək vacib oldu." Ustadı Molla Abdullah isə ona belə cavab verir: "Mən də elə əvvəldən sənə bunu demək istəyirdim, amma 'təyəmmün və təbərrük' ifadəsi ilə bunu bildirmişdim."[1196] Çox maraqlıdır ki, daha sonra Muhəmməd Təqi əl-Məclisi və xüsusilə oğlu Muhəmməd Baqir əl-Məclisi bu bidəti şiələrin arasında normallaşdırmaqda müstəsna rol oynayıblar. Onuncu və on birinci əsrdəki şiə alimlərinin əksəriyyəti hələ də kitablarında bu bidəti normallaşdırmamışdılar. Doqquz və onuncu əsrlərdə yaşamış Şeyx Muflih Sayməri əl-Bəhrani misal üçün "Ğayətul-Məram" kitabında, əl-Muhəqqiq əl-Kərki (vəfatı h. 940) "Cəmi əl-Məqasid" adlı şərhində, "əl-Muxtəsar ən-Nəfi", "Şərai əl-İsləm", "İrşədul-Əzhən" kimi kitablara

---

[1195] əs-Səvzəvari, "Zəxiratul-Məad", 2/254;

[1196] Bax: əl-Məclisi, "Ləvami Sahib Qurani", 3/566-567;

yazdığı haşiyələrində, Seyyid Muhəmməd bin Əli əl-Musəvi əl-Amili (vəfatı h. 1009) "Mədarikul-Əhkam" kitabında namaz haqqında danışarkən üçüncü şəhadəti heç cür müzakirə etmirlər. əş-Şəhid əs-Səni'nin oğlu Həsən bin Zeynuddin əl-Amili (vəfatı h. 1011) və onun oğlu Muhəmməd bin Həsən və həmçinin əş-Şeyx əl-Bəhəi kimi on birinci əsrin şiə fəqihləri də bu məsələyə toxunmurlar. Lakin onlarla eyni zamanda yaşamış Muhəmməd Təqi əl-Məclisi, əl-Muhəqqiq əs-Səbzəvari və əl-Feyd əl-Kəşəni bu məsələni müzakirə ediblər. Muhəmməd Təqi əl-Məclisi'yə gəldikdə o, "Ravdul-Muttəqin" kitabında əs-Saduq'a etiraz edərək deyir: "Bu xəbərlərin onların uydurmalarından olduqlarına qəti hökm vermək müşkildir. Halbuki, bizim qeyd etdiyimiz — və etmədiyimiz — əlavələr və əskiklər ilə bağlı rəvayətlər çoxdur. Görünən budur ki, (azanda) bu əlavə sözlərin olması ilə bağlı rəvayətlər üsul kitablarda mövcud imiş və həm də səhih olublar, necəki bu, əl-Muhəqqi (əl-Hilli), əl-Alləmə (əl-Hilli) və əş-Şəhid'in - rahiməhumullah - sözlərindən anlaşılır, çünki onlar bu xəbərləri "şazz" kateqoriyasına nisbət ediblər və "şazz" məşhur olmayan səhih xəbərə deyilir. Bununla belə (bu xəbərlərin) əksinə səhih olduğuna hökm verdikləri xəbərlər də - öyrəndiyin kimi - şazdır. Beləliklə də mufəvvidanın və ya əhli-sünnətin bir məsələ üzərində əməl etməsi, o şeyin inkarına və ya uydurma olmasına qəti dəlil sayıla bilməz, ancaq məsumlardan - saləvatullahi aleyhim - buna dəlalət edəcək xəbərlərin gəlməsi istisnadır, lakin burda belə xəbərlər varid olmayıb. Üstəlik qədim və indiki zamanda şiələr bununla əməl ediblər. Zahir olan budur ki, bu bununla bir kəs əməl edərsə günah etmiş olmaz, bunun azanın məşru bir hissəsi olduğuna qərar verməsi halı istisnadır, o zaman xəta etmiş olacaq. Bu sözləri azanın bir hissəsi olaraq yox, imanın bir hissəsi olaraq demək daha yaxşıdır… Bununla belə əs-Səduq'un "mufəvvida" dedikdə hansı camaatı qəsd etdiyi də məlum deyildir. Burdan anlaşılan - qarşıda gələcəyi kimi - budur ki, Peyğəmbərin səhv edə biləcəyini deməyən hər kəsin mufəvvida olduğunu deyir və Peyğəmbərdən olan ibadətlərə əlavə etmək rəyində olan hər kəs ona görə mufəvviddir. Əgər bunu qəsd edirsə o zaman əs-Saduq və şeyxi (İbnul-Valid)dən başqa bütün şiələr mufəvvida olur. Yox əgər başqaları nəzərdə tutulursa, onların dəqiq məzhəbi bizə məlum deyil ki, onları iftira və lənətlərlə ittiham edək. Bəli, imamların ilah və ya peyğəmbər olduğunu deyənlər isə şübhəsiz məlundurlar."[1197] əl-Məclisi'nin sözlərini kiçik bir yeri istisna olmaqla tam şəkildə tərcümə etdik ki,

[1197] əl-Məclisi, "Ravdul-Muttəqin", 2/245-246;

onun yanaşmasını doğru şəkildə anlayaq. Burada önəmli olan nöqtə budur ki, əl-Məclisi özünün də görmədiyi, heç zaman qarşılaşmadığı rəvayətləri əcaib bir şəkildə səhih çıxarır. İddiasına görə əl-Muhəqqiq əl-Hilli, əl-Alləmə əl-Hilli və əş-Şəhid əl-Əvvəl kimi alimlər əs-Saduq'un uydurma adlandırdığı rəvayətlərə şazz deyərkən bununla o rəvayətlərin səhih, lakin qeyri-məşhur olduqlarını qəsd ediblər. Hər şeydən əvvəl düzəliş etməyimiz lazımdır ki, bu rəvayətlərin şazz olduğunu bu alimlər deməyiblər, bunu Şeyxut-Taifə ət-Tusi deyib və adını çəkdiyi alimlər sadəcə olaraq ət-Tusi'nin sözlərini nəql ediblər. Onların özlərinin o rəvayətləri görüb görmədikləri məlum deyildir. ət-Tusi'nin bu rəvayətləri "şazz" adlandırmağını fürsət görüb o rəvayətlərin sənədlərini səhih çıxarmağa gəldikdə isə bu, xətalı və ucuz bir yanaşmadır, çünki - Şeyx Heydər Hubbullah'ın da qeyd etdiyi kimi - şazz sözü ümumi mənada zəif və məchul hədislər üçün də işlənir.[1198] Görəsən nə üçün əs-Saduq və əş-Şəhid əs-Səni kimi alimlər bu rəvayətlərin uydurma olduğunu dedikləri halda buna tabe olmadıqları halda ət-Tusi'nin "şazz" sözünü istilahi mənaya həml edərək oradan rəvayətlərin səhihliyini çıxarmağa çalışır, halbuki nə o rəvayətləri, nə də onların sənədlərini görməyib. Muhəmməd Təqi əl-Məclisi qısaca olaraq bu əlavə sözləri azanın tərkib hissəsindən görməsə də onları deməyi caiz hesab edir, hətta oğlu Muhəmməd Baqir əl-Məclisi qeyd edir ki, atası ömrünün sonunda rəyindən dönmüş və bu əlavə sözlərin azanın tərkib hissəsindən olduğunu, o sözləri deməyin də müstəhəb olduğunu deyən rəyi mənimsəmişdi.[1199] Muhəmməd Baqir əl-Məclisi (h. 1037-1111) özü isə buyurur: "(Əlinin) vilayətinə şəhadət gətirməyin azanın müstəhəb hissələrindən olması rəyi uzaq ehtimal deyil. Çünki Şeyx (ət-Tusi), əl-Allamə, əş-Şəhid və başqaları bu barədə rəvayətlərin gəldiyini bildirmişlər..." Daha sonra onların sözlərinə yer verir və həmçinin ət-Tabrasi'nin "əl-İhticac" kitabında keçən sənədsiz bir xəbəri zikr edir və deyir: "Əgər müəzzin və ya iqamə deyən şəxs bu şəhadəti azanın bir hissəsi olmaq məqsədi ilə deyil, bərəkət niyyəti ilə söyləsə, bunda heç bir günah yoxdur. Çünki alimlər azan və iqamə zamanı danışmağa ümumi şəkildə icazə vermişlər. Bu isə duaların və zikrlərin ən şərəflilərindəndir."[1200] Qəribədir ki, əl-Məclisi öz atası kimi heç zaman görmədiyi və qarşılaşmadığı rəvayətləri bu məsələyə dəlil olaraq göstərir. Ondan sonra Nimətullah əl-Cəzəiri (h. 1050-1112),

[1198] https://hobbollah.com/p/50024/

[1199] əş-Şəhristani, "Əşhədu Ənnə Aliyyən Valiyullah", səh: 362;

[1200] əl-Məclisi, "Bihərul-Ənvar", 81/111-112;

Muhəmməd bin Hüseyn əl-Xavansəri (v. h. 1112), əl-Vahid əl-Bəhbəhəni (h. 1117-1205), Muhəmməd Əli əl-Kirmənşəhi (v. h. 1216), Cəfər Kəşiful-Ğita (h. 1228) Mirzə Əbul-Qasim əl-Qummi (h. 1152-1231), Seyyid Əli ət-Tabətabəi (h. 1231), Əhməd ən-Nəraqi (h. 1245), Muhəmməd Baqir əş-Şəfəti (h. 1260), Muhəmməd Həsən ən-Nəcəfi (h. 1266), Murtəda əl-Ənsari (h. 1281), Əli əz-Zəncani (h. 1290) Əli Bəhrul-Ulum (h. 1298), Mirzə Mahmud əl-Burrucurdi (h. 1300), Cəfər ət-Tustəri (h. 1303) kimi alimlər müəzzinin bu sözləri təbərrük niyyəti ilə deməyini müstəhəb hesab edirlər.[1201] Digər tərəfdən əl-Məclisi gördüyümüz kimi bunun azanın bir hissəsi olduğunu, bunu deməyin müstəhəb olduğunu söyləyir. Yusuf əl-Bəhrani (h. 1107-1186) onun bu rəyini gözəl hesab edir və Hüseyn əl-Bəhrani (h. 1216) qəti şəkildə bunu müstəhəb əməllərdən hesab edir.[1202] Seyyid Muhəmməd əş-Şirazi və Şeyyid Sadiq əş-Şirazi də bunun azanın müstəhəb bir hissəsi olduğuna inanırlar. Muhəmməd Təqi Mufti əş-Şiə əl-Ərdəbili də "əl-Urvatul-Vusqa" kitabına yazdığı təliqatlarında bunu azanın bir hissəsi saymaq rəyini məqbul hesab etmiş, Şeyx Muhəmməd Sənəd isə bunu isbat etmək üçün ayrıca kitab qələmə almışdır. Həmçinin Cəmil Həmmud əl-Amili, Nəcah ət-Tai, Yəsubuddin Rastəkar Cuybəri kimi şiə müəlliflər də üçüncü şəhadətin azanın tərkib hissəsi olduğunu deyiblər. Bu gün şiə alimləri arasında vilayət şəhadətinin azanın tərkib hissəsi olduğunu deyənlər olsa da əksəriyyət bunun tərkib hissəsi olduğunu demir, lakin təbərrük niyyəti ilə azanın içində bu sözləri deməyi icazəli hesab edirlər. Yalnız az sayda şiə alimi mütləq şəkildə azanda bu şəhadəti bidət olaraq inkar ediblər.[1203]

---

[1201] əl-Cəzəiri, "əl-Ənvar ən-Numəniyyə", 1/169; əl-Xavansəri, "Ədəbus-Salət", (fars dilindədir və "Rasəil - Sittu Aşəra Risələ" külliyyatının tərkibində (səh: 421) çap olunub. əl-Bəhbəhəni, "Məsabih əz-Zaləm", 7/31-34; əl-Kirmənşahi, "Məqamiul-Fədl", 2/203; Cəfər Kəşiful-Ğita, "Kəşful-Ğita", 3/143-145; əl-Qummi, "Ğanəimul-Əyyəm", 2/422-423 və "Mənəhicul-Əhkəm", səh: 180; ət-Tabətabəi, "Riyədul-Məsəil", 3/96-98; ən-Nəraqi, "Mustənəduş-Şiə", 4/386-487; əş-Şəfəti, "Mətaliul-Ənvar", 1/249; əl-Ənsari, "ən-Nuxbə", səh: 52; əz-Zəncani, "Nizamul-Fəraid", səh: 327; Bəhrul-Ulum, "Burhənul-Fiqh", 3/110; əl-Burrucurdi, "əl-Məvahibus-Səniyyə", 3/328-329; ət-Tustəri, "Minhəcur-Raşəd", səh: 175

[1202] əl-Bəhrani, "əl-Hədəiq ən-Nədira", 7/404; əl-Bəhrani, "əl-Fərhatul-Unsiyyə", səh: 227-228;

[1203] Bunlardan biri böyük şiə alimi Şeyx Muhəmməd Mehdi əl-Xalisi (1888-1963) olub. Ona görə azanda bu sözləri deyən istər bu sözlərin azanın bir hissəsi olduğuna etiqad etsin, istərsə də etməsin fərq etməz. "Burada niyyət mövzudan heç bir şey dəyişdirmir, bunun misalı sübhün nafiləsini üç rükət qılıb üçüncü rükətin o namazdan olduğuna niyyət etməməsidir." bax: Haşim əd-Dəbbağ, "əl-İməm əl-Mucəhid - əş-Şeyx Muhəmməd əl-Xalisi", səh: 94

Şiə alimləri azanda bunu deməyin müstəhəbliyi üçün göstərə bildikləri ən güclü dəlil ət-Tabrasi'nin "əl-İhticac" kitabında rəvayət etdiyi bu hədisdir: "Sizdən biriniz "lə iləhə illəllah və Muhəmməd Rasulullah" dedikdə qoy "Əli əmirul-muminin" də desin!"[1204] Əhməd bin Əli ət-Tabrasi bu rəvayətin isnadını qeyd etmədən rəvayət edir, sadəcə olaraq deyir ki, əl-Qasim bin Müaviyə bunu İmam əs-Sadiq'dən rəvayət edib. ət-Tabrasi hicri altıncı əsrdə yaşamış bir şiə alimidir, onunla Cəfər əs-Sadiq arasında ən az dörd əsr fərq vardır. Bu sözləri azanın tərkib hissəsi olaraq deməyin müstəhəbliyi üçün bəzən maraqlı dəlillərlə də qarşılaşırıq. Muhəmməd Said əl-Hakim "Minhəcus-Salihin" kitabında deyir ki, "sünnilərin əlyazma kitablarından birində keçir ki, Əbu Zər - radiyallahu anhu - azan verdi və azanda Əlinin - aleyhissələm - vilayəti ilə şəhadət gətirdi. Səhabələr bunu Allahın elçisinə - salləllahu aleyhi va əlihi va səlləm - şikayət etdilər, o isə Əbu Zərin əməlini təsdiqlədi."[1205] Şiə alimi sünnilərə aid olan bu əlyazma kitabın hansı kitab olduğunu bizə xəbər vermir. Seyyid Əli əş-Şəhristani isə nəql edir ki, həm Əbu Zərr, həm də Salman əl-Farisi azanı bu şəkildə oxuyublar, səhabələrdən bəziləri bunu şikayət etdikdə "elə etiqad ediblər ki, Peyğəmbər bu əməli münkər hesab edəcək və onların ikisini də danlayacaq, lakin onlar özləri danlandılar."[1206] əş-Şəhristani deyir ki, Şeyx Abdunnəbi əl-İraqi ona Mirzə Hadi əl-Xatib əl-Xorasani'dən və başqalarından, onlar da Şeyx Muhəmməd Taha'dan, o isə dinində etibar etdiyi məchul bir şəxsdən rəvayət edir ki, o, Dəməşqdəki "Zahiriyyə" kitabxanasında saxlanan və hicri yeddinci əsrdə yaşamış misirli alim Şeyx Abdullah əl-Mərağİ'yə aid olan "əs-Suləfə fi Əmr əl-Xiləfə" adlı kitabda bu rəvayətlə qarşılaşıb. Bu misirli sünni alimi və onun kitabını sitat gətirən şiə müəlliflər çoxdur. Onu Muhəmməd Sənəd "əş-Şəhədə əs-Səlisə" kitabında, Sadiq Mehdi əl-Hüseyni "Ali fil-Quran" kitabında, Abdurrazzəq Muqarram "Sirrul-İmən" kitabında və çox sayda şiə alimlər və yazıçılar kitablarında bu xəbərləri zikr edirlər. Seyyid Əli əl-Hüseyni əl-Miləni də bu iki xəbəri qeyd edir və arxasınca etiraf edir ki, nə bu sünni müəllifini, nə də kitabını tanımır, heç zaman görməyib.[1207] Həqiqət budur ki, hicri yeddinci əsrə aid belə bir misirli sünni alimi yaşamayıb və onun "əs-Suləfə" adlı kitabı da yoxdur, bu sadəcə olaraq hansısa bir nəfərin uydurduğu xəbərdir ki,

---

1204 ət-Tabrasi, "əl-İhticac", 1/231;

1205 əl-Hakim, "Minhəcus-Salihin", 1/201;

1206 əş-Şəhristani, "Əşhədu Ənnə Aliyyən Valiyullah", səh: 203;

1207 əl-Miləni, "əş-Şəhədətu bil-Vilayəti fil-Əzən", səh: 26;

tədricən şiə kitablarına yol tapa bilib. Çünki İsmail Paşa Bağdadi'nin "Hədiyyətul-Arifin" və "İydahul-Məknun" kitablarında, Ömər Rida Kəhələ'nin "Mucəmul-Muəllifin", Fuad Sezkin'in "Tarixut-Turas əl-Arabi", Carl Brockelmann'ın "Tarixul-Ədəb əl-Arabiyyə", Haci Xəlifə'nin "Kəşfuz-Zunun", Siddiq Həsən Xan'ın "Əbcədul-Ulum" kimi fıhrıstlarında axtarış etdikdə belə bir kitab adı ilə rastlaşmaq olmur, heç kim belə bir müəllifə aid bu adda bir kitab zikr etmir. Bu gün əz-Zahiriyyə kitabxanası kataloqlaşdırılıb və kitabxanada mövcud olan bütün əlyazmaların siyahısı mövcuddur və bu kataloqların içində araşdırma etdikdə belə bir kitabla qarşılaşmaq olmur.

Beləliklə də qarşımızda canlanan mənzərəni bir daha gözdən keçirməyimiz lazımdır. əs-Saduq'un dönəmində uydurma rəvayətlərə əsaslanan, aşırı kafir şiə qruplarının əməli olan bir bidət tədricən bizim zamanımıza qədər ciddi bir dəyişiklikdən keçdi; bu gün bu əməl ya təbərrük niyyəti ilə edilir, ya da birbaşa azanın bir hissəsi olaraq əməl olunur. Peyğəmbərimizin - aleyhissalətu vassələm - zamanında öyrətdiyi azan şiə məscidlərdə dəyişdirilib və açıq-aşkar bidət olduğunu gördüyümüz bir əməl bu gün şüara çevrilib.

## Beşinci misal: Aşura orucu

İmami şiələrində imamlardan qalan mirasın halını göstərə biləcək bir başqa misal aşura gününün orucudur. Şiə alimi Muhəmməd Kazim əl-Yəzdi "əl-Urvatul-Vusqa" kitabında aşura orucunu məkruh oruclar arasında qeyd edərkən[1208] digər şiə alimi əl-Xoyi bununla bağlı bir haşiyə açır və yazır: "(Müəllif) bunu şeyxlərdən bəzilərinə tabe olaraq məkruh oruclardan sayıb, lakin əl-Muhəqqiq (əl-Hilli) "əş-Şərai" kitabında onu müstəhəb oruclardan sayıb, (ən-Nəcəfi) "əl-Cəvahir" kitabında "bunda heç bir ixtilaf tapmadan" deyərək bunu təsdiqləyir, hətta "əl-Ğunyə" kitabındakı sözlərin zahiri bunda icma olduğunu göstərir." əl-Xoyi daha sonra qeyd edir ki, əl-Hilli "əş-Şərai" kitabında

[1208] əl-Yəzdi, "əl-Urvatul-Vusqa", səh: 3/660;; Maraqlıdır ki, əl-Yəzdi "məkruh" sözü ilə qəsd etdiyi məna savabının az olduğu oruclardır. Bu isə əhlüs-sünnətdəki məkruh mənası ilə eyni deyildir.

bu orucun müstəhəbliyini hüzn qeydi ilə zikr edir və ən-Nəcəfiyə istinadən əlavə edir ki, əl-Hilli bu qeydində Şeyxut-Taifə ət-Tusiyə tabe olub, "yoxsa bu mövzudakı xəbərlərdə bu qeyd yoxdur." Daha sonra əl-Xoyi əlavə edir: "İstənilən halda nə əl-Muhəqqiq (əl-Hilli), nə də "əl-Cəvahir" kitabının sahibi məkruh oruc haqqnda danışarkən bu günün orucunu orada zikr etmir, beləliklə də bu ikisinin sözlərindən anlaşılır ki, onlar bu orucu ya hüzn məqsədilə, ya da mütləq olaraq müstəhəb hesab edirlər." əl-Xoyi daha sonra aşura orucunun haram olması rəyini bəzi şiə alimlərindən nəql edir. Bu rəydə olan alimlər öz imamlarına nisbət etdikləri bəzi xəbərlərə əsaslanırlar. Misal üçün bu xəbərlərdən birində guya Cəfər əs-Sadiq'dən aşura orucu haqqında soruşurlar və o, cavab verir: "Kim bu günü oruc tutarsa ona düşən pay İbn Mərcənə və Ziyad ailəsinə düşən pay olacaq." Soruşdular: "Onların payı nədir?" Dedi: "Atəş."[1209] əl-Xoyi bu və digər xəbərlərə toxunaraq deyir: "Bir qrup xəbərlərdə bu günü oruc tutmağın qadağan olması varid olub və bu xəbərlərin sayı çox olsa da hamısı sonunda üç rəvayətə dayanır…" Daha sonra əl-Xoyi bu xəbərlərin hamısının isnad baxımından zəif olduğunu bəyan edir və deyir: "Bu rəvayətlərin hamısı zəifdir. Bəli, burada sənədi səhih olan tək bir rəvayət vardır və bu, Zurara və Muhəmməd bin Muslim'in hər ikisinin də rəvayət etdikləri səhih xəbərdir ki, hər ikisi Əbu Cəfər əl-Baqir'dən – aleyhissələm – aşura gününün orucu haqqında soruşdular və dedi: "Bu günün orucu ramazan ayı (nazil olma)dan əvvəl idi, ramazan ayı nazil olduqda tərk olundu." Lakin – gördüyün kimi – burada qadağan yoxdur, əksinə ən uzağı o günün orucunun ramazan ayı nazil olduqdan sonra tərk olunmuş və nəsx olunmuş olması mənası vardır, ola bilsin ki, əvvəllər vacib idi, sonra ramazan ayı ilə əvəz olundu, necəki əvəz olunmanın mahiyyəti bunu tələb edir. Beləliklə də (bu xəbər) bu orucu tutmağın caizliyi bir tərəfdə qalsın, heç müstəhəbliyinin nəfy edilmiş olmasına heç bir şəkildə dəlalət etmir." Daha sonra əl-Xoyi deyir: "İstənilən halda qadağan edici rəvayətlərin heç birinin sənədi təmiz deyildir, əksinə hamısı zəifdir və "əl-Hədaiq" kitabının müəllifinin etdiyi kimi əks dəlilləri təqiyyə mənasında yozmağımız üçün əlimizdə etimad edə biləcəyimiz mötəbər bir rəvayət yoxdur. Bu günü oruc tutmağın əmr olunmasına və müstəhəbliyinə dair rəvayətlərə gəldikdə isə onların sayı çoxdur, misal üçün əl-Qaddəh'in səhih xəbəri: "Aşura gününün orucu bir ilin kəffarəsidir." (Həmçinin) Məsədə bin Sadaqa'nın muvəssəq xəbəri: "Aşuranı, doqquzuncu və onuncu günləri oruc tutun, çünki o,

---

[1209] əl-Kuleyni, "əl-Kəfi", 4/147;

bir ilin günahının kəffarəsidir." əl-Xoyi yekun olaraq qeyd edir ki, "ən güclü rəy bu günü oruc tutmağın özlüyündə müstəhəb olmasıdır..."[1210] "əl-Ğunyə" kitabı ilə qəsd olunan altıncı əsrdə yaşamış şiə alimi Həmzə bin Əli bin Zəhra əl-Hələbi'nin yazdığı "Ğunyətun-Nuzu ilə İlmeyyil-Usul val-Furu" kitabıdır. Orada aşura günü hüzn ilə oruc tutmağı müstəhəb oruclar arasında qeyd edir.[1211] Beləliklə də Əbul-Qasim əl-Xoyi aşura günü mütləq olaraq oruc tutmağın müstəhəb olduğunu təsdiqləyir. Həmçinin "Cəvahirul-Kələm" kitabının sahibi Muhəmməd Həsən ən-Nəcəfi buna yaxın bir rəy müdafiə edir.[1212] Şeyx ət-Tusi'nin "ən-Nihəyə" kitabındakı rəyi də bu mənada qəbul edilir,[1213] çünki oruc tutmaq seçimi olan günlər arasında şəvval və arafə gününün orucları ilə yanaşı aşura orucunu da qeyd edir. Şeyx əs-Saduq "əl-Xisal" kitabında bunun eynisini zikr edir.[1214]

Əgər şiə alimlərinin bu barədə öz kitablarındakı rəvayətlərin içərisindən çıxmaq cəhdlərinə baxdığımızda çox qəribə və ziddiyyətli bir mənzərə ilə qarşılaşırıq. əl-Xoyi'nin sözlərindən aydın oldu ki, şiə kitablarında aşura günü oruc tutmağa təşviq edən xəbərlər mövcuddur və bunların isnadları səhihdir. Digər tərəfdən onların kitablarında bu orucu qadağan edən, bu gün oruc tutmağı atəşə vəsilə edən səbəblərdən sayan xəbərlər də çoxdur, isnadları zəif olsa da şiə alimləri bu xəbərlərə etimad gözü ilə baxıblar. Ona görə də gəldikləri nəticələr təzadlı və ixtilaflı olub. Şiələrdə üsul və fiqh mədrəsəsini təmsil edən alimlərin arasında klassik dövrü təmsil edən əl-Mufid, ət-Tusi, İbn Zəhra kimi alimlərin bu xəbərlərin arasında tutduqları yol bu xəbərlərin arasını birləşdirməkdir. Misal üçün Şeyx əl-Mufid deyir: "Kim aşura günü nasibilərin o günün orucunun fəzilətinə etiqad etdiklərinə əsasən o (gün)ün bərəkəti və səadəti üçün oruc tutarsa günah etmişdir, kim Allahın elçisinin – salləllahu aleyhi va əlihi – müsibətinə üzülərək, onun ailəsinin – aleyhimussələm – başına gələnlərə ağrı duyaraq oruc tutarsa haqqa isabət etmiş və əcr qazanmışdır."[1215] Bu izah nə qədər qəribə izah olsa da qəbul etməliyik ki, əl-Mufid tələbəsi ət-Tusi'də olduğu kimi bu günü hüzr və kədərlə oruc tutmağı icazəli sayır. Lakin rəvayətləri bu

---

1210 "əl-Mustənəd fi Şərh əl-Urvatil-Vusqa", 22/313-317; Muəssəsətu İhyə Əsər əl-İməm əl-Xui, 2009

1211 Ibn Zəhra, "Ğunyətun-Nuzu", 1/148; Muəssəsətul-İməm əs-Sadiq, 1417

1212 ən-Nəcəfi, "Cəvahirul-Kələm", 17/541-548; Muəssəsə ən-Nəşr əl-İsləmi, 1431

1213 ət-Tusi, "ən-Nihəyə", 1/169;

1214 əs-Saduq, "əl-Xisal", səh: 536;

1215 əl-Mufid, "əl-Muqnia", səh: 377-378; Darul-Mufid, 1431

şəkildə cəm etmək çox qəribədir, çünki şiə rəvayətləri özləri təsdiq edirlər ki, aşura gününün fəziləti vardır. İmam əl-Hüseyn'nin fəzilətli bir gündə vəfat etməsi həmin günü öz fəzilətindən məhrum etməz.

Daha sonrakı dönəmi təmsil edən şiə alimləri məsələyə fərqli gözlə yanaşıblar. Misal üçün Yusuf əl-Bəhrani kitabında əl-Mufid'in bu rəyinə etiraz edərək deyir ki, "bu xəbərlərin bu günün orucunun mütləq şəkildə haram olmasına dəlaləti aşkar və sarihdir..." Ona görə də əl-Bəhrani öz kitablarında imamların bu orucun fəziləti ilə bağlı sözlərini təqiyyə mənasında yozur. əl-Bəhrani deyir: "əl-Qəddah'ın və Məsədə bin Sadaqa'nın bu orucun bir ilin kəffarəsi olmasına dəlalət edən xəbərlərinə və ikincidə bu orucun əmr olunmasına gəldikdə isə bu, təqiyyə mənasına həml olunmaqla anlaşılır." əl-Bəhrani hüzn və kədər məqsədi ilə oruc tutmaq metodunu tamamilə inkar edir və deyir ki, "əl-Hüseyn bin Əbi Ğandər'in atasından rəvayət etdiyi xəbərdə orucun müsibət üçün tutulmaması, əksinə yalnız sağlığa şükür olaraq tutulması mənası aşkar ikən (belə bir izah) necə mümkün ola bilər?!"[1216] əl-Bəhrani'nin etirazı yerindədir, çünki oruc Allaha ibadətdir və Allaha ibadət hüzn və kədər ilə yox Onun nemətlərinə şükür etmək, Onun fəzilətlərinə nail olmaq mənasında edilər. əl-Məclisi də eynilə əl-Bəhrani kimi düşünür və deyir: "Mənə görə üstün rəy budur ki, bu günün orucunun fəziləti haqqında gəlmiş xəbərlər təqiyyə mənasında yozulmalıdır..."[1217] Aşura orucunun fəzilətini təsdiqləyən, bunu əmr edən xəbərləri təqiyyə halına aid edən şiə alimləri arasında həmçinin Əhməd əl-Xavansəri'ni də göstərmək olar.[1218] Şiə alimləri arasında aşura orucuna tərğib göstərən xəbərləri ümumən yalanlamaq, inkar etmək yolunu seçən alimlər də az deyildir. Onların arasında ən məşhuru Fəqih Əhməd ən-Nəraqi adlandırdıqları şiə alimidir ki, o, "Mustənəduş-Şiə" kitabında qədim şiə alimlərinin aşura günü orucunu hüzn və kədər qeydi ilə müstəhəb saymaqlarını qəbul etmir, bu yolu qəti şəkildə inkar edir. "Doğru yolun tələbi" – onun nəzərində - "birinci növ xəbərləri tamamilə rədd etməkdir, çünki (bu xəbərlər) sünni tayfalarından ən çirkin olanlara qəti şəkildə müvafiqdir." ən-Nəraqi bu məzhəbi əl-Feyd əl-Kəşəni'yə nisbət edir.[1219] Şiə alimlərinin bir hissəsi

---

[1216] əl-Bəhrani, "əl-Hədaiq ən-Nədira", 13/344; Darul-Ədva, Beyrut, 1413

[1217] əl-Məclisi, "Mirətul-Uqul", 16/361; Darul-Kutub əl-İsləmiyyə, Tehran, 1406

[1218] Bax: əl-Xivansəri, "Cəmi əl-Mədərik", 2/226; Məktəbətu əs-Saduq, 1405;

[1219] ən-Nəraqi, "Mustənəd əş-Şiə", 10/492; Muəssəsətu Al Beyt, Beyrut, 1429;

ümumiyyətlə aşura günü oruc tutmağın yox, lakin əsrin vaxtına qədər yeyib-içməkdən imtina etməyin müstəhəb olduğunu deyirlər.

Bu, qısa şəkildə şiə alimlərindən fərqli yanaşmaların ərzi idi. Beləliklə də imamların elminə varis olduqlarını iddia edən şiə alimləri aşura orucu ilə bağlı bir-birinə ziddiyyətli mövqelər seçiblər. əl-Mufid, ət-Tusi kimi şiə alimlərinin sözlərində, İbn Zəhra əl-Hələbinin icma nəqlindən anlaşılır ki, aşura gününün orucunun müstəhəbliyi əvvəllər sünnilər və şiələr arasında ittifaq halı olub, lakin aradakı tək fərq bu orucu tutmaq qəsdində idi; yəni sünnilər bu günün fəzilətinə, bu günün peyğəmbərin – aleyhissalətu vassələm – sünnəti olduğuna inanaraq tutduqları halda, şiələr bu günü hüzn və kədər günü olması məqsədi ilə oruc tutmağı doğru hesab ediblər. Bunlardan çox-çox sonra gəlmiş bəzi şiə alimləri bu metodun heç cür uyğun gəlmədiyini gördükləri üçün haqlı olaraq etiraz etdilər ki, İslam dinində oruc tutmaq nemətə şükür olaraq gəlib, hansısa bir günün bərəkətinə görə savaba nail olmaq üçün gəlib, amma heç bir yerdə hüzn və kədər üçün gəlməyib, çünki məlum məsələdir ki, oruc Allah üçün edilən ən əzəmətli ibadətlərdəndir və orucu tutan məhz Allahı razı salmaq üçün, Ona yaxınlaşmaq üçün, Onun nemətlərinə şükür göstərmək üçün tutur. Burada həmçinin əl-Mufid kimi şiə alimlərinin xəbərləri cəm etməklərindəki daha önəmli bir problemə işarə etmək olar. O da budur ki, şiə kitablarında aşura orucunun fəziləti haqqında gəlmiş xəbərlər məhz o günün fəziləti və bərəkəti üzərində vurğu edərək bu orucu təşviq edirlər, yəni bu orucun bir ilin kəffarəsi olduğunu deyirlər. Necə olur ki, əl-Mufid və tələbələri isnad baxımından daha zəif olan qadağanedici xəbərləri inkar etmək əvəzinə, bu orucun fəzilətini təsdiqləyən xəbərlərin mahiyyətini inkar edirlər, çünki əl-Mufid deyir ki, o günün fəzilətinə, bərəkətinə inanaraq oruc tutan günah etmiş olur, amma öz kitablarındakı səhih xəbərlər isə deyir ki, o günü oruc tutmağın fəziləti və bərəkəti vardır və bu, bir ilin kəffarəsinə bərabərdir. Beləliklə də əl-Mufidin metodu cəm deyil, lakin ziddiyyətə düşməkdir. Üstəlik isnad baxımından daha səhih olan xəbərləri, isnadı - əl-Xoyi'nin göstərdiyi kimi - problemli olan, məchul olan xəbərlərə uyğunlaşdıraraq zahirini təhrif etmək necə doğru ola bilər?! Orucun fəziləti haqqında gəlmiş xəbərlərlə ümumiyyətlə əməl etməyən, bu orucu məkruh və ya haram sayan şiə alimlərinə gəldikdə isə onların seçdikləri təqiyyə izahı çox fasid bir nəticəyə gətirib çıxarır. Necə demək olar ki, əhlul-beyt imamları təqiyyə edərək, yəni özlərini düşmənin şərrindən qoruyaraq Allahın dini haqqında yalan məlumatlar öyrədiblər. Arqument xatirinə fərz edək ki, əhlul-beyt imamları

dövrünün hakimlərinin zülmündən özlərini qorumaq üçün təqiyyə ediblər, məgər bu, onlara icazə verirmi ki, sual verənlərə Allahın dini haqqında yalan hökmlər öyrətsinlər?! Təqva əhli olan imamlara necə bu çirkin xisləti yaraşdırmaq olar? Məgər bu imamlar – ey şiə qardaşım! – sizin öz etiqadınıza görə Allahın yer üzündəki hüccəti və insanlara doğru dini öyrətmək üçün mükəlləf olan məsumlar deyilmi?! Onların camaatın din haqqındakı suallarına təqiyyə adı ilə tamamilə xətalı məlumat vermək haqqı varsa o zaman insanlara necə doğru dini öyrətmək vəzifəsinə sahib ola bilərlər?! Üstəlik təqiyyə metodunu seçənlər başqa bir problemlə də üzləşirlər; necə olur ki, keçmiş şiə alimləri bu günün orucunun müstəhəbliyi üzərində ittifaq ediblər və ya ittifaqa yaxın bir rəydə olublar? Məgər bu, ilk dönəmlərdə bu orucu tamamilə inkar edənlərin olmadığını və ya onların saylarının əhəmiyyətsiz dərəcədə az olduğunu göstərən güclü bir dəlil deyildirmi?

Doğru olan budur ki, aşura gününün orucu sünnət əhlinin xəbərlərində mütəvatir dərəcəsindədir. əs-Suyuti bunu mütəvatir hədislər arasında qeyd edir.[1220] Bunu təxminən iyirmi dörd səhabə rəvayət edib; onların arasında Abdullah ibn Abbas, Əli bin Əbi Talib, Abdullah bin əz-Zubeyr, Cabir bin Abdilləh kimi səhabələr də vardır. Bu orucu əməvilərin çıxardığını iddia etmək həm tarixə, həm də şiə kitablarındakı xəbərlərə ziddir. Ona görə də şiə alimlərindən Əbul-Həsən əş-Şərani "əl-Vafi" kitabına yazdığı qeydində çox haqlı bir söz yazır. O deyir: "Müxaliflərə ədavətində həddi aşan və əhlul-beyti - aleyhimussələm - sevməyənlərə müxalifət etməkdə mübaliğə edən ravilərdən bəziləri olur ki, xilaf əhlinə (yəni sünnilərə) müxalif olmaq məqsədi ilə həddi aşırlar və əsassız əməllərdən əl çəkmirlər; şiəliklə bağlılıqlarının şiddəti onları bunu etməyə sövq edir; necəki son əsrlərdə bir qrup (şiələr)in müxaliflərə müxalif olmaq üçün aşura orucunun müstəhəbliyini inkar edirlər, halbuki müstəhəbliyi üzərində ittifaq vardır və (həmçinin) əhlul-beytin düşmənlərini gözdən salmaq üçün Quranın təhrif olunduğunu deyirlər."[1221] Bizə məlumdur ki, bu orucu şiddətlə tövsiyə edən səhabələrin başında Əli bin Əbi Talib gəlir. Əbu Davud ət-Tayəlisi deyir: "Şubə bizə rəvayət etdi; dedi: Əbu İshaq (əs-Səbii) mənə xəbər verdi; dedi: əl-Əsvad bin Yezidi belə deyərkən eşitdim: "Heç kimi Əli bin Əbi Talib və Əbu Musa (əl-Əşari) qədər aşura orucunu əmr edən görmədim."[1222] Həmçinin İbn Əbi Şeybə "əl-

---

[1220] əs-Suyuti, "Qatful-Əzhər əl-Mutənəsira", səh: 135; əl-Məktəb əl-İsləmi, Beyrut, 1405

[1221] əl-Kəşəni, "Kitəb əl-Vafi", 22/506; Məktəbətul-İməm Əmir əl-Muminin Əli, İsfahan 1430

[1222] Əbu Davud ət-Tayəlisi, "əl-Musnəd", 2/537 (rəq. 1308)

Musannəf" kitabında deyir: "Əbul-Əhvas bizə Əbu İshaq'dan, o da əl-Haris'dən, o da Əli bin Əbi Talibdən rəvayət etdi ki, "o, aşura gününün orucunu əmr edərdi."[1223] Sünni kitablarında keçən bu səhih xəbərləri bir də şiə kitablarında keçən bu muvassəq xəbər ilə müqayisə edin. ət-Tusi "əl-İstibsar" kitabında deyir: "Əli bin əl-Həsən bin Fəddal, Harun bin Muslim'dən, o da Məsədə bin Sadəqa'dan, o da Əbu Abdilləh'dən aleyhissələm, o isə öz atasından (rəvayət etdi) ki, Əli – aleyhiməssələm – dedi: "Aşuranı, ayın doqquzunu və onunu oruc tutun, çünki o, bir ilin günahlarının kəffarəsidir."[1224] Şiə kitabları həmçinin qeyd edirlər ki, əl-Hüseyn - radiyallahu anhu - özü şəhid edilərkən oruclu idi. Beləki qeyd etdikləri xəbərə əsasən Hüseyn səhurda əshabına gördüyü bir yuxunu danışır: "Mən yuxuda gördüm ki, itlər mənə hücum edərək üstümə atıldılar və məni dişləyirdilər. Onların içində bir ləkəli (ala-bula) it vardı ki, mən onu ən şiddətli hücum edəni gördüm. Zənn edirəm ki, mənim qətlimi həyata keçirəcək şəxs də bunların içindən bir ləkəli və cüzamlı adam olacaqdır. Sonra isə gördüm ki, babam Rəsulullah (salləllahu aleyhi və alih) bir qrup səhabəsi ilə birlikdə mənim yanıma gəldi və mənə belə dedi: "Ey oğlum! Sən, Məhəmməd ailəsinin şəhidisən! Göylər əhli və yüksək məqam sahiblərinə sənin gəlişinin müjdəsini vermişəm. Bu gecə iftarını mənim yanımda aç! Tezləşdir, gecikdirmə!"[1225]

Şiələrdə aşura orucunu qadağan edən rəvayətlərə nəzər salsaq görəcəyik ki, həqiqətən də Əbul-Qasim əl-Xoyi'nin dediyi kimi şiə alimlərinin öz meyarlarına görə heç biri salamat deyildir, hamısının sənədi zəifdir, bəziləri şiddətli şəkildə zəifdir. Misal üçün "əl-İstibsar" kitabında ət-Tusi deyir: "Muhəmməd bin Yaqub – Əli bin İbrahim'dən – o atasından – o da Nuh bin Şueyb ən-Neysəburi'dən – o da Yasin əd-Darir'dən, o isə Hariz'dən, o isə Əbu Cəfər və Əbu Abdilləh'dən – aleyhissələm – (rəvayət etdi) ki, onlar dedilər: "Aşura günü və arafə gününü nə Məkkədə, nə Mədinədə, nə öz vətənində, nə də şəhərlərdən hansısa bir şəhərdə oruc tutma!"[1226] Bu isnaddakı Nuh bin Şueyb və Yəsin əd-Darir məchul ravilərdir.[1227] "əl-İstibsar" kitabındakı növbəti rəvayəti ət-Tusi belə qeyd edir: "Ondan – o da əl-Həsən bin Əli əl-

---

[1223] İbn Əbi Şeybə, "əl-Musannəf", 2/312 (rəq. 9363)

[1224] ət-Tusi, "əl-İstibsar", 2/134 (rəq. 437)

[1225] İbn Asəm əl-Kufi, "Kitəbul-Futuh", 5/99-100; əl-Məclisi, "Bihər əl-Ənvar", 45/3; əl-Xavarazmi, "Məqtəl əl-Huseyn", 1/251;

[1226] ət-Tusi, "əl-İstibsar", 2/134 (rəq. 440)

[1227] bax: Muhəmməd əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 643 və 658;

Haşimi'dən, o isə Muhəmməd bin Musa'dan, o da Yaqub bin Yezid'dən, o da əl-Vaşşə'dən; dedi: - Nəciyə bin əl-Haris əl-Attar mənə rəvayət etdi; dedi: Əbu Cəfər'dən – aleyhissələm – aşura gününün orucu haqqında soruşdum və dedi: "Ramazan ayının endirilməsi ilə tərk edilmiş bir orucdur və tərk olunmuş olan şey bidətdir." Nəciyyə dedi: "Atasından sonra mən Əbu Abdilləh'dən – aleyhissələm – soruşdum və atasının verdiyi cavabın eynisi ilə cavabladı və sonra dedi: "Bu, kitabda haqqında bir şeyin gəlmədiyi və Hüseyni – aleyhissələm – öldürməkdə Ziyad ailəsinin qoyduğu bir sünnətdən başqa heç bir sünnətə uyğun olmayan bir günün orucudur."[1228] Bu rəvayəti həmçinin əl-Kuleyni "əl-Kafi" kitabında rəvayət edir və isnadda Nəciyə yerinə Nəcbə bin əl-Haris əl-Attar deyir və əl-Vaşşə isə əl-Həsən bin Əli əl-Vaşşə olaraq keçir. Bu isnadda birdən çox problem vardır; əl-Həsən bin Əli əl-Həşimi məchuldur. əl-Cəvahiri "əl-Mufid min Mucəm Ricəl əl-Hədis"də onu məchul ravi sayır. Muhəmməd bin Musa'ya gəldikdə isə o, Muhəmməd bin Musa bin İsa əl-Həmdəni'dir. Muhəmməd əl-Cəvahiri onun zəif olduğunu yazır.[1229] Hüseyn əs-Saidi onun haqqında xülasə hökmü belə verir: "Zəifdir, yalançıdır, hədis uydurandır; onu İbnul-Valid, əs-Saduq, İbn Nuh, İbnul-Ğadairi zəif sayıblar və onun zəifliyini ən-Nəcəşi nəql edib. əl-Alləmə əl-Hilli, İbn Davud, əl-Cəzəiri, Muhəmməd Taha Nəcəb və əl-Bəhbudi onu zəiflər arasında sayıblar." əs-Saidi daha əvvəl yazır: "əs-Saduq dedi: Ğadir-Xum gününün namazı və o gün oruc tutanın savabı haqqındakı hədisə gəldikdə isə şeyximiz Muhəmməd bin əl-Həsən – radiyallahu anhu – onu səhih saymazdı və deyərdi: "Bu, Muhəmməd bin Musa əl-Həmdəni yolu ilədir, yalançı və qeyri-siqa biri olub."[1230] Nəcbə və ya Nəciyə bin əl-Haris əl-Attar'a gəldikdə isə şiə ricəl kitablarında adında və kimliyində ixtilaf vardır, özü isə məchuldur. Növbəti hədisi ət-Tusi belə rəvayət edir: "Ondan – o da əl-Həsən bin Əli əl-Haşimi'dən, o isə Muhəmməd bin İsa bin Ubeyd'dən (rəvayət edir) ki, dedi: "Qardaşım Cəfər bin İsa mənə rəvayət etdi; dedi: "ər-Rida'dan – aleyhissələm – aşura orucu və insanların bu barədə dedikləri haqqında soruşdum. Dedi: "İbn Mərcənənin orucu haqqındamı məndən soruşursan? Bu, Ziyad ailəsindən zina balalarının Hüseynin qətlinə görə oruc tutduqları gündür..." Sonra bir qədər uzun olan xəbəri qeyd edir.[1231] Gördüyümüz

---

[1228] ət-Tusi, "əl-İstibsar", 2/134-135 (rəq. 441)

[1229] bax: Muhəmməd əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 138, 151 və 582;

[1230] əs-Saidi, "əd-Duafə min Ricəl əl-Hədis", 3/272-274;

[1231] ət-Tusi, "əl-İstibsar", 2/135 (rəq. 442)

kimi bunun da isnadında əl-Haşimi keçir və o, məlum olduğu kimi məchuldur. Muhəmməd bin İsa bin Ubeyd'ə gəldikdə isə Cəfər əl-Hilli "Nukət ən-Nihəyə" kitabında onu zəif ravi saymış. Şeyxut-Taifə ət-Tusi də onu zəif sayıb. əş-Şəhid əs-Səni onun haqqında "ən səhih rəyə əsasən o, zəifdir" yazır. İbn Mutahhər əl-Hilli bir yerdə rəvayətinin qəbul olduğunu, digər yerdə isə təvaqquf etdiyini yazır.[1232] Qardaşı Cəfər bin İsa isə məchuldur.[1233] Sonrakı hədisi ət-Tusi belə qeyd edir: "Ondan – o da əl-Həsən bin Əli əl-Haşimi'dən, o da Muhəmməd bin İsa'dan; dedi: Muhəmməd bin Əbi Umeyr bizə Zeyd ən-Nərsi'dən rəvayət etdi; dedi: Ubeyd bin Zurara bizə rəvayət etdi; dedi: Zurara'nı Əbu Abdilləh'dən – aleyhissələm - aşura orucu haqqında soruşarkən eşitdim. Dedi: "Kim o günü oruc tutarsa ona düşən pay İbn Mərcənə və Ziyad ailəsinə düşən pay olacaq." Dedim: "Bəs onların bu gündən payı nədir?" Dedi: "Atəş."[1234] Isnadındakı əl-Haşimi və Muhəmməd bin İsanın məchul olması barədə məlumat verdik. Üstəlik bu isnaddakı Zeyd ən-Nərsi də məchuldur; əl-Cəvahiri onun məchul olduğunu qeyd edir.[1235] əl-Kuleyni "əl-Kəfi" kitabında deyir: "Ondan, o da Muhəmməd bin əl-Hüseyn'dən, o da Muhəmməd bin Sinan'dan, o da Əbən'dən, o da Abdulməlik'dən belə dediyini (rəvayət etdi) : Əbu Abdilləhdən – aleyhissələm – məhərrəm ayının doqquzu və onu oruc tutmaq haqqında soruşdum. Dedi: "Doqquzu Hüseynin və yoldaşlarının Kərbalada mühasirəyə alındığı, Şam əhlinin atlılarının onlara qarşı birləşdikləri gündür, İbn Mərcənə və Ömər bin Sad atlıların çoxluğuna sevindilər və Hüseyni zəif düşürdülər... heç belə bir gündə oruc olarmı?!..." Xəbəri uzun bir şəkildə rəvayət edir.[1236] Burada isnadda əl-Kuleyni "ondan" dedikdə əl-Haşimi'ni qəsd edir və onun məchul olduğunu qeyd etdik. İsnadda həm də Muhəmməd bin Sinan da yer alır. əl-Kəşşi və ət-Tusi onun haqqında "məşhur yalançılardandır" yazır. Seyyid Haşim əl-Həsəni yazır ki, "onun təkzibində və rəvayətlərinə etimad edilməyəcəyində ittifaq vardır." əl-Musəvi onun "çox zəif" olduğunu yazır, əş-Şəhid əs-Səni isə yalan və başqa ittihamlarla ona

---

[1232] Bax; əl-Hilli, "Nukət əl-Hidəyə", 2/204; əl-Hilli, "Xulasətul-Əvqal", səh: 81; əş-Şəhid əs-Səni, "Məsəlikul-Əfhəm", 13/462;

[1233] bax: Əhməd əl-Amili, "Mənəhicul-Əxyər", 1/665; Həsən əl-Amili, "Muntəqa əl-Cumən", 1/219; Muhəmməd bin əl-Həsən, "İstiqsa əl-İtibar", 7/440;

[1234] ət-Tusi, "əl-İstibsar", 2/135 (rəq. 443)

[1235] əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 239;

[1236] əl-Kuleyni, "əl-Kəfi", 4/147-148;

qarşı edilmiş cərhin çox böyük olduğunu deyir.[1237] Aydın olur ki, bu xəbərin də sənədində məchul və yalançı ravilər vardır. Muhəmməd ət-Tusi "əl-Əməli" kitabında deyir: "əl-Hüseyn bin İbrahim əl-Qazvini bizə xəbər verdi; dedi: Əbu Abdilləh Muhəmməd bin Vahbən bizə rəvayət etdi; dedi: Əbul-Qasim Əli bin Həbəşi bizə rəvayət etdi; dedi: Əbul-Fədl əl-Abbas bin Muhəmməd bin əl-Huseyn bizə rəvayət etdi; dedi: Atam bizə rəvayət etdi; dedi: Safvan bin Yəhya bizə əl-Hüseyn bin Əbi Ğandər'dən, o da atasından, o da Əbu Abdilləh'dən rəvayət etdi ki, ondan soruşdum: ..." Bəs aşura orucu?" Dedi: "Bu, Hüseynin qətl edildiyi gündür və əgər buna görə sevinirsənsə oruc tut!" Sonra dedi: "Umeyyə ailəsi və Hüseyni qətl etməkdə onlara Şam əhlindən kömək edənlər nəzir boyuna aldılar ki, əgər Hüseyn öldürülərsə, onunla çıxanlar təslim olarsa və xilafət Əbu Sufyan ailəsinə keçərsə həmin günü bayram edəcəklər və o gün şükür olaraq oruc tutacaqlar. Beləliklə də bu, bizim bu günə qədər Əbu Sufyan ailəsindən bir sünnət oldu və insanlar onlara tabe oldular... sonra dedi: "Oruc müsibət səbəbilə tutulmaz, oruc yalnız sağlıq nemətinə şükür olaraq tutular və Hüseyn müsibətə düçar oldu; əgər bu, sənin üçün də müsibətdirsə o günü oruc tutma..."[1238] Şiə alimi Mahmud əl-Haşimi əş-Şəhrudi bu isnad haqqında yazır: "Bu sənəddə bir neçə məchul ravi vardır; onlardan biri Əbu Ğangər, digəri Əbul-Fədl əl-Abbas və atasıdır, bir başqası əl-Hüseyn bin İbrahim əl-Qazvini'dir."[1239] əl-Hüseyn bin İbrahim əl-Qazvini, əl-Hüseyn bin Əbi Ğangər, atası Əbu Ğandər hamısı məchul ravilərdir. əl-Cəvahiri'nin bu adlar altında "əl-Mufid" kitabında yazdıqlarına baxsaq görəcəyik ki, onlar haqqında "məchul" olduqlarını yazır, Əli bin Həbəşi haqqında isə "siqa olması sabit deyildir" buyurur.[1240] ət-Tusi "Misbəh əl-Muctəhid" kitabında deyir: "Abdullah bin Sinan rəvayət edir; deyir: Aşura günü ağam Əbu Abdilləh Cəfər bin Muhəmmədin yanına daxil oldum və onu rəngi solmuş, hüznü aşkar, gözlərindən yaş tökülmüş mirvari tək axarkən gördüm. Soruşdum: "Ey Allah elçisinin oğlu! ... Ey Ağam, bəs bu günün orucu haqqında nə deyirsən?" Dedi:"Gecədən niyyət tutmadan tut, iftarı da açarkən sevinmə və həmin günün orucunu kamil etmə, qoy iftarın əsr namazından bir saat sonra bir qurtum su içməklə olsun..." Sonra xəbəri

---

[1237] ət-Tusi, "İxtiyər Mərifətur-Ricəl", 2/823; əş-Şəhid əs-Səni, "Məsəlikul-Əfhəm", 11/456; əl-Musəvi, "Mədarikul-Əhkəm", 1/247; Haşim əl-Həsəni, "Dirasət fil-Hədis val-Muhəddisin", səh: 297;

[1238] ət-Tusi, "əl-Əməli", səh: 667;

[1239] əş-Şəhrudi, "Ədva va Əra", 2/387;

[1240] əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 161, 162, 388 və 718

uzun şəkildə zikr edir.[1241] Lakin bu xəbərin isnadı yoxdur, ona görə də Əbul-Qasim əl-Xoyi haqlı olaraq buyurur: "Lakin problem bunun sənədindədir, aşkar olan sənədinin zəif olmasıdır, çünki Şeyxin "əl-Misbəh"də rəvayət etdiyində Abdullah bin Sinən'ə qədər olan rəvayət kanalı məchuldur, beləliklə də mürsəl hökmündə olmalıdır."[1242] Beləliklə də şiə kitablarında aşura orucunun qadağan olması haqqında keçən xəbərlərin heç biri öz meyarlarına görə səhih deyildir, bu xəbərlər məchul və yalan arasında gəzib dolaşır, onlardan heç biri ən aşağı səhihlik dərəcəsinə belə çatmır. Ona görə də Əbul-Qasim əl-Xoyi kimi şiələr bu xəbərlərin etimaddan uzaq olduğunu etiraf edirlər.

## Cəfər əs-Sadiq'in misalı

Cəfər əs-Sadiq sünnət əhlinin nəzərində böyük bir imamdır, alimdir və Allah dostudur. Rəvayət elmində sünnət əhlinin alimləri onun nəql etdiyi xəbərlərə etibar ediblər və dörd məzhəbin böyükləri Cəfər əs-Sadiqi yalnız xeyirlə yad ediblər. İmam Əbu Hənifə onun haqqında deyib: "Cəfər bin Muhəmməd'dən daha fəqih birini görmədim."[1243] İmam Malik isə deyir: "Cəfər bin Muhəmmədin yanına gedərdim, bir müddət onun yanına çox gedib gəldim və onu yalnız bu üç haldan biri üzərində görərdim: ya namaz qılardı, ya oruclu idi, ya da Quran oxuyardı."[1244] İshaq bin Rahaveyh bir dəfə əş-Şafi ilə müzakirəsində ondan soruşur: "Sənin nəzərində Cəfər bin Muhəmməd necədir?" Dedi: "Siqadır."[1245] Yəni mötəbərdir, sözündə doğru danışandır. Amr bin Əbil-Miqdəm isə deyir: "Cəfər bin Muhəmmədə baxdığımda onun peyğəmbərlər sülaləsindən olduğunu görürdüm."[1246] Yəhya bin Main deyir: "Hafs bin Ğiyəs, Abadana - bura ibadət üçün ayrılmış bir yer idi - getdi və Bəsrəlilər onun ətrafına toplaşdılar və ona dedilər: "Bizə üç nəfərdən rəvayət etmə: Əşəs ibn

[1241] ət-Tusi, "Misbəh əl-Muctəhid", səh: 782;
[1242] əl-Xoyi, "əl-Mustənəd fi Şərhil-Urvatil-Vusqa", 22/318;
[1243] İbn Adiy, "əl-Kəmil fi Duafə ər-Ricəl", 2/358;
[1244] əl-Cövhəri, "Musnəd əl-Muvatta", səh: 286;
[1245] İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 2/487;
[1246] İbn Adiy, "əl-Kəmil fi Duafə ər-Ricəl", 2/357;

Əbdül-Məlik, Əmr ibn Ubeyd və Cəfər ibn Məhəmməd." O cavab verdi: "Əşəsə gəlincə, o, sizindir, onu sizə buraxıram. Əmr ibn Ubeydə gəldikdə isə, siz onu daha yaxşı tanıyırsınız. Cəfər ibn Məhəmmədə gəlincə, əgər Kufədə olsaydınız, (belə bir söz dediyiniz üçün) sizi ayaqqabıları ilə döyərdilər."[1247] Yəhya bin Main özü - əd-Dərimi'nin rəvayət etdiyi kimi - ondan İmam Cəfər haqqında soruşulduqda onun "siqa" olduğunu deyir.[1248] Böyük hədis alimi Əbu Zura ər-Razi'dən bir məclisdə İmam Cəfərin öz atasından, Suheyl bin Əbi Saleh'in öz atasından və əl-Alə'nin öz atasından rəvayət etdikləri barəsində soruşulduqda o belə demişdi: "Cəfər heç bir şəkildə bunlarla müqayisə oluna bilməz." Abdulğani əl-Məqdisi bunu şərh edərkən deyir ki, "yəni onlardan üstündür."[1249] Qeyd edək ki, Suheyl bin Əbi Saleh və əl-Alə bin Abdirrahmən bin Yaqub sünnət əhlinin nəzərində etibarlı ravilər, sünnətin nəqlində imamlar sayılırlar; əz-Zəhəbi hər ikisi haqqında danışdıqda onları "imam" olaraq vəsf edir. Beləliklə də başa düşürük ki, burada məsələ sadəcə siqa və etibarlılıq məsələsi deyildir, Cəfər əs-Sadiq bunlarla müqayisə olunmayacaq dərəcədə üstün bir mərtəbədədir. Abdurrahmən bin Əbi Hətim ər-Razi deyir: "Atamı belə deyərkən eşitdim: "Cəfər bin Muhəmməd siqadır, onun kimi birisi haqqında soruşulmaz."[1250] İbn Hibban onu belə vəsf edir: "O, əhlul-beytin seyyidlərindən, tabiinin abidlərindən və Mədinə əhlinin alimlərindən biri idi."[1251] Əbu Əhməd bin Adiyy əl-Curcəni deyir: "Cəfər bin Muhəmməd'in atası vasitəsilə Cabirdən, həmçinin atası vasitəsilə onun atalarından çox sayda hədisləri vardır, əhlul-beytə aid nüsxələr Cəfər bin Muhəmmədin rəvayəti ilə mövcuddur. Ondan İbn Cureyc, Şubə bin əl-Həccəc kimi imamlar və başqaları hədis rəvayət ediblər ki, onlardan bəzilərini zikr etdim və bəzilərini zikr etmədim. Cəfər insanların siqa olanlarındandır…"[1252] İbn Məncuveyh deyir: "Fəzilət, elm, ibadət, şərəf, hifz və itqan baxımından Mədinə əhlinin seyyidlərindən (ağalarından) və Qureyşin şərəflilərindən idi."[1253] Beləliklə də təkcə elm, fəzilət, ibadət və şərəf baxımından deyil, həm də hədisləri hifz etməkdə, onları mükəmməl şəkildə əda etməkdə

---

[1247] İbn Mihraz, "Tərixu İbn Məin", 1/148;

[1248] əd-Dərimi, "Tərixu İbn Məin", səh: 84;

[1249] əl-Məqdisi, "əl-Kəməl fi Əsmə ər-Ricəl", 4/41;

[1250] İbn Əbi Hətim, "əl-Cərh vat-Tədil", 2/487;

[1251] İbn Hibban, "Məşəhir Uləmə əl-Əmsar", səh: 206;

[1252] İbn Adiyy, "əl-Kamil fi Duafə ər-Ricəl", səh: 2/360;

[1253] İbn Məncuveyh, "Ricəl Sahih Muslim", 2/13;

seçilirdi. İbn Abdilbərr onun haqqında danışarkən deyir ki, "siqa, əmin idi, əql və hikmət sahibi idi, vəra sahibli fəzilətli biri idi… sözünün çoxu hikmət idi."[1254] İmam ən-Nəvəvi onunla bağlı yazır: "Onun imamlığı, fəziləti və seyyidliyi üzərində ittifaq ediblər."[1255] İbn Teymiyyə onun haqqında "əhlüs-sünnətin ittifaqı ilə din imamlarından biridir" yazır.[1256] əs-Səxavi isə deyir: "Fiqh, elm, fəzilət və səxavət baxımından əhlul-beytin seyyidlərindən idi, dəyərinin ucalığına, fəzilətinə, elminə və şərəfinə görə xilafət məqamına yaraşırdı. Onun fəzilətləri kitabları dolduracaq qədər çoxdur."[1257] İmam Cəfər haqqında sünnət əhlinin mədhedici sözlərini yazıb qurtarmağı qarşımıza məqsəd qoysaydıq cildlərlə kitab yazmaq mümkün olardı. Bunu deməliyik ki, sünnət əhli hamılıqla ittifaq edib ki, Cəfər əs-Sadiq din və sünnət imamlarından olub. Onu heç kim bidətdə ittiham etməyib, əksinə onun dində, fəzilətdə, sünnətdə seyyid və qüdvət olduğunu deyiblər. Hədis rəvayətinə gəldikdə isə cüzi istisna[1258] olmaqla hamılıqla onun siqa və

---

[1254] İbn Abdilbərr, "ət-Təmhid", 2/69;

[1255] ən-Nəvəvi, "Təhzibul-Əsmə val-Luğat", 1/150;

[1256] İbn Teymiyyə, "Minhəc əs-Sunnə", 2/176;

[1257] əs-Səxavi, "ət-Tuhfətul-Lətifə", 1/242;

[1258] Aləuddin Muğlətay "İkməlu Təhzibil-Kəməl" kitabında (2/115) deyir: "İbn Sad "ət-Tabəqat" kitabında dedi: "Çox hədis rəvayət edən idi, hüccət olaraq götürülməz, zəif hesab olunur. Bir dəfə soruşuldu: "Atandan rəvayət etdiyin bu hədisləri onun özündən eşitmisən?" Dedi: "Bəli." Bir başqa dəfə eyni sual verildikdə dedi: "Bunları sadəcə olaraq kitablarında tapmışam." Hər şeydən əvvəl qeyd edək ki, bu gün çap olunmuş "ət-Tabəqat əl-Kubra" nüsxələrinin heç birində bu sözlər keçmir. Əgər bu doğrudursa görünür ki, İbn Sad'ın onu zəif hesab etməsi, atasının hədislərini birbaşa eşitməsi yoxsa kitablardan götürməsi məsələsi ilə bağlıdır. İbn Həcər "Təhzibut-Təhzib" kitabında (1/311; ər-Risələ çapı) bununla bağlı deyir: "Ola bilsin ki, bu iki sual tamamilə fərqli hədislər haqqında soruşulub; beləliklə də birbaşa atasından eşitdikləri hədislərdə atasından eşitdiyini deyib, eşitmədiklərini isə (kitablarında) tapdığını deyib. Bu isə əksinə onun rəvayətində necə diqqətli davrandığına dələlət edir." İbn Adiy "əl-Kəmil fi Duafə ər-Ricəl" kitabında (2/356) deyir ki, Əli bin əl-Mədini deyib: "Yəhya bin Said'dən Cəfər bin Muhəmməd haqqında soruşuldu və dedi: "Ondan (gələn hədisdə) qəlbimdə bir şeylər var." Dedim: "Bəs Mucalid?" Dedi: "Mucalid mənim üçün ondan daha sevimlidir." Bu sözlər İmam Cəfər haqqında deyilmiş cərh mənasındakı daha bir misaldır. İmam əz-Zəhəbi bunu "əs-Siyər" kitabında (6/256) bu şəkildə qeyd edir: "Yəhya bin Said dedi: "Cəfər bin Muhəmməd mənə uzun hədisi - yəni həcc barəsində olan hədisi - imla etdi. Sonra dedi: Nəfsimdə onunla bağlı bir şey var, Mucalid mənim üçün daha sevimlidir." Bunu nəql etdikdən sonra əz-Zəhəbi deyir: "Bu, Yəhya əl-Qattan'ın sürüşmələrindən biridir. Əksinə, bu sahənin imamları icma ediblər ki, Cəfər Mucalid'dən daha etibarlıdır və Yəhyanın sözlərinə əhəmiyyət verməyiblər." Əhlüs-sünnət kitablarında Cəfər əs-Sadiq haqqında deyilmiş bundan ağır sözlər tapa bilməzlər. Şiə qardaşlarımız bəzən bu kimi sözləri nəql edərək sünnət əhlinin sanki Cəfər əs-Sadiqə qarşı qərəzli mövqedə olduğunu göstərmək istəyirlər. Halbuki İmam Cəfər haqqında şiə kitablarında İmam Cəfər haqqında deyilmiş sözlər daha ağırdır. əl-Kəşşi isnadı ilə rəvayət

etibarlı olduğunu deyiblər. əl-Buxari'nin "əs-Sahih" kitabında ondan hədis rəvayət etməməsinə gəldikdə isə buradan əl-Buxari'nin ona qarşı mənfi rəydə olması mənasını çıxartmaq yalnışdır, çünki əl-Buxari "əs-Sahih" kitabında eyni şəkildə Muhəmməd bin İdris əş-Şafi, Əbu Ubeyd əl-Qasim bin Səlləm, Həmməd bin Sələmə, Əbu Davud ət-Tayəlisi, Məymun bin Mehran, Muhəmməd bin Rumh, Davud bin Əbi Hind və daha bir çox sünnət imamlarından, böyük alimlərdən hədis rəvayət etməyib. Əhməd bin Hənbəl kimi böyük hədis alimindən təkcə iki hədis, Yəhya bin Main'dən isə bir hədis rəvayət etmişdir. Bütün bunlar heç bir şəkildə əl-Buxari'nin bu alimlərə qarşı mənfi rəydə olduğuna dəlalət etməz.

Əhlus-sunnət kitablarında əhlul-beytin böyüklərinin sözlərinə həm etiqadi, həm də fiqhi məsələlərdə önəm verilib. Bunun misalları kitablarımızda kifayət qədər çoxdur. Abdurrazzəq "əl-Musannəf" kitabında deyir: "İbrahim bin Muhəmməd'dən, o da Cəfər bin Muhəmməd'dən (rəvayət etdi) ki, "Əli atəşdə bişmiş şeylərə görə dəstəmaz almazdı." Bir başqa yerdə İmam Cəfər vasitəsilə atasından rəvayət edir ki, əl-Həsən və əl-Hüseyn üzüklərinə Allahın zikrini nəqş etmişdilər. Bir digər rəvayətdə yenə Cəfər öz atasından rəvayət edir ki, Cibril peyğəmbərin - salləllahu aleyhi va səlləm - yanına gəlib namazın fərz olduğunu öyrətdikdə, məğrib namazından başqa digər namazların hamısını iki vaxtda qıldı, yalnız məğribi tək bir vaxtda qıldı. Abdurrazzəq namazın qısaldılması ilə bağlı Sufyan əs-Səvri vasitəsi ilə İmam Cəfər'dən, o da atasından rəvayət edir ki, Əli - radiyallahu anhu - deyib: "Bir yerdə on gün iqamə edəcəksənsə namazları tam qıl. Əgər bu gün və ya sabah yola çıxacam deyərək bu şəkildə bir ay qalmış olsan belə namazları iki rükət qıl!" Abdurrazzəq daha sonra bunun eynisini İbrahim vasitəsilə Cəfərdən rəvayət etdiyini deyir. Bir başqa yerdə Məkkənin imamı İbn Cureyc vasitəsilə Cəfər əs-Sadiq'dən belə dediyini rəvayət edir ki, Əli bin Əbi Talibə insanların duha namazı qıldıqları zikr olunardı və o deyərdi: "Bacardığınız qədər qılın, şübhəsiz ki, Allah namaza görə əzab etməz!" İbrahim bin Muhəmməd vasitəsilə Cəfər əs-Sadiq'dən, o da atasından rəvayət edir ki, Əli - radiyallahu anhu - bayram namazlarında birinci rükətdə yeddi dəfə, ikincisində beş dəfə təkbir gətirərdi. Bir xəbərdə Abdurrazzəq yenə İbn Cureyc'dən rəvayət

---

edir (bax: "İxtiyər Mərifətir-Ricəl", 1/389) ki, İbn Muskən deyib: "Zurara'nı belə deyərkən eşitdim: "Əbu Cəfərə Allah rəhm etsin, Cəfərə gəldikdə isə ona qarşı qəlbimdə etiraz var." Ona dedim: "Zurara'nı bu sözü deməyə vadar edən nə idi?" Dedi: "Bu sözləri deməyə vadar edən, Əbu Abdilləh'in onun eyiblərini ifşa etməsi olmuşdu."

edir: "Cəfər bin Muhəmməd bizə atasından, o da Ubeydullah bin Əbi Rafi'dən belə dediyini rəvayət etdi: "Əbu Hureyra bizə cüməni qıldırardı və birinci rükətdə bizə Cümə surəsini, ikincisində isə "izə cəəkəl-munəfiqun" surəsini oxuyardı. Çıxmaq istədikdə Əbu Hureyra'ya çatdım və dedim: "Ey Əbu Hureyra, səni bu iki surəni oxuyarkən eşitdim və Əli bin Əbi Talib Kufədə onları oxuyardı." Əbu Hureyra dedi: "Onları Allahın elçisi - salləllahu aleyhi va səlləm - oxuyardı." Bir başqa məsələdə Cəfər əs-Sadiqdən rəvayət edir ki, bayram namazı ilə cümə namazı eyni günə düşdükdə Əli bin Əbi Talib bayram namazı qılanlara cüməyə gəlməməyə izn verərdi. Yenə İmam Cəfər vasitəsi ilə atası İmam əl-Bariqin belə dediyini rəvayət edir ki, Əli bin Əbi Talib bayram namazlarına qüsl alardı. Cənazə babında peyğəmbərin - salləllahu aleyhi va səlləm - qəbrində necə dəfn olunmasını, onun zamanında qəbrin üzərinə su səpilməsini, Fatimənin - radiyallahu anhə - hər cümə Həmzə'nin qəbrini ziyarət etməsini və digər xəbərləri İmam Cəfər vasitəsilə atası Muhəmməd əl-Baqir'dən rəvayət edir. Eyni şəkildə zəkat, oruc və digər bablarda onlarla məsələdə ya tək İmam Cəfərdən, ya onun vasitəsilə İmam əl-Baqir'dən, ya da onların rəvayəti ilə İmam Əlidən rəvayətlər zikr edir. Bu əhəmiyyəti və etinanı İbn Əbi Şeybə'nin "əl-Musannəf" kitabında da görə bilirik. İbn Əbi Şeybə bir yerdə misal üçün deyir: "Yəhya bin Said bizə Cəfər bin Muhəmməd'dən, o da atasından belə dediyini rəvayət etdi: "Atamdan Kəbədə namaz qılmaq barədə soruşuldu və o, dedi: "Atam Hüseyn bin Əli ilə birlikdə Kəbədə namaz qılmışam."[1259] Digər rəvayətdə deyir: "Vaki bizə Sufyan'dan, o da Cəfər bin Muhəmməd'dən, o isə atasından rəvayət etdi ki, peyğəmbər - salləllahu aleyhi va səlləm - bir şahidin şahidliyi və bir yəminə əsasən hökm verib."[1260] Yenə bir başqa rəvayətdə deyir: "Hətim bin İsmail bizə Cəfər bin Muhəmməd'dən, o da atasından belə dediyini rəvayət etdi: "Əli dedi: "Kişi istərsə öz ummu-vələdini azad edər və azad etməni onun mehri hesab edə bilər."[1261] Sünnət kitablarının böyük əksəriyyətində məşhur səhabə Cabir bin Abdilləh əl-Ənsari'nin peyğəmbərin - salləllahu aleyhi va səlləm - həcci ilə bağlı rəvayətlərinin ciddi bir hissəsini İmam əl-Baqir və oğlu Cəfər yolu ilə rəvayət edirlər. Əhlüs-sünnət fəqihləri kitablarında bir çox yerdə digər imamlarla yanaşı Cəfər əs-Sadiq'in də məzhəbini qeyd edirlər. Misal üçün İbn Qudəmə heyvanı

---

[1259] İbn Əbi Şeybə, "əl-Musannəf", 8/487

[1260] Eyni mənbə, 12/520;

[1261] Eyni mənbə, 20/243;

kəsərkən bəsmələ etməyi unutduqda ətin halal olduğunu deyən fəqihlərin adlarını bu cür sadalayır: “Ata, Tavus, Said bin əl-Museyyəb, əl-Həsən, Abdurrahmən bin Əbi Leyla, Cəfər bin Muhəmməd və Rabia.”[1262] ən-Nəvəvi özü üçün həcc və ya ümrə etməmiş bir kimsənin başqasının adına həcc və ya ümrə etməsinin keçərli olması haqqında danışarkən deyir: “əl-Həsən əl-Basri, Cəfər bin Muhəmməd, Əyyub əs-Səxtiyəni, Ata, ən-Nəxai və Əbu Hənifə dedilər ki, keçərlidir.”[1263] Eyni şəkildə əqidə məsələlərində də buna önəm veriblər. Misal üçün İbn Cüzey əl-Kəlbi təfsir kitabında əl-Araf surəsi 54-cü ayədə keçən “sonra ərşin üzərinə istiva etdi” sözləri ilə bağlı İmam Malik’in “istiva məlumdur, keyfiyyəti məchuldur, bu barədə soruşmaq bidətdir” dediyini nəql etdikdən sonra əlavə edir: “Malikin sözünün eynisi Əbu Hənifə’dən, Cəfər əs-Sadiq’dən və əl-Həsən əl-Basri’dən rəvayət olunub.”[1264] Yaxud peyğəmbərin - salləllahu aleyhi va səlləm - Rəbbini isra gecəsi görməsi haqqında danışarkən deyir: “İbn Abbas, əl-Həsən, Muhəmməd bin Kəb, Cəfər bin Muhəmməd və başqalarından nəql olunub ki, bu, peyğəmbərin - salləllahu aleyhi va səlləm - Rəbbinə yaxınlaşmasıdır və ya Allahın yaxınlaşmasıdır. Bu rəyə əsasən yaxınlaşmaq burada təvil olunmalıdır, zahirinə görə anlaşılmamalıdır. Əksinə Cəfər bin Muhəmməd’in dediyi kimi Allahın yaxınlaşmasının heç bir həddi yoxdur.”[1265] Əgər biz Cəfər əs-Sadiq’in və atasının sünnət əhlinin kitablarında keçən fətvaları, təfsirləri, qiraətləri və rəvayətləri haqqında yazmalı olsaq ayrıca bir kitab hasil olar.

Şiə kitablarında Cəfər əs-Sadiq’dən rəvayət edən ravilərin sayı inanılmaz dərəcədə çoxdur. Şeyxut-Taifə ət-Tusi bu ravilərin sayını müəyyən etməyə çalışmış və onların 3050 nəfər olduğunu qeyd etmişdir.[1266] Bəzi müasir müəlliflər ayrıca kitab yazaraq ondan rəvayət etmiş raviləri bir araya toplamağa çalışmışdır; misal üçün Abdulhüseyn əş-Şəbəstəri iki cildlik kitabında bu ravilərin sayını 3759-a çatdırıb, onların arasında kufəli olanların sayı 1800 nəfər edir, Cəfər əs-Sadiq’in öz şəhəri Mədinədən olan ravilərin sayı isə təxminən 150 nəfərdir. Yəni ravilərin heç dörd faizini təşkil etmir.[1267] Burada maraqlı olan

---

[1262] İbn Qudəmə, “əl-Muğni”, 13/290;

[1263] ən-Nəvəvi, “əl-Məcmu Şərh əl-Muhəzzəb”, 7/118;

[1264] İbn Cuzey, “ət-Təshil li Ulum ət-Tənzil”, 1/290;

[1265] ən-Nəvəvi, “Şərh Sahih Muslim”, 3/4

[1266] Həsən əs-Sadr, “Nihəyətud-Dirayə”, səh: 401;

[1267] əş-Şəbəstəri, “əl-Fəiq fi Ruvat va Əshab əl-İmam əs-Sadiq”, kitabın tamamı ravilərin adlarından və haqlarındakı qısa məlumatlardan ibarətdir.

tərəf budur ki, Cəfər əs-Sadiq - iddia olunduğuna görə - şiddətli nəzarət altında təqiyyə etməyə məcbur olduğu halda ondan dörd minə yaxın ravi hədis rəvayət edib. Əhlüs-sünnətin imamları təqiyyə etmədikləri halda, dərsləri hər kəsə açıq olduğu halda və hədis rəvayət edənlərin sayı şiələrdəkindən qat-qat çox olmağına baxmayaraq heç bir əhlüs-sünnət alimin bu qədər rəvayətçisi olmayıb. İmam Malik'dən rəvayət etmiş ravilərin sayının min üç yüz nəfər olduğu deyilib.[1268] Maliki alimləri bunu qeyd edərkən ravilərin çoxluğu ilə fəxr edirlər. Məlumdur ki, İmam Malik sağlığında elə bir şöhrət sahibi idi ki, onun yanına Əndəlüs və Xorasandan tələbələr gəlirdilər. Əhlüs-sünnətin ən böyük imamlarından sayılan Əhməd bin Hənbəl'dən rəvayət edənlərin sayına gəldikdə isə ən-Nəbulsi onların sayının 567 nəfər olduğunu deyib, İbnul-Cəvzi bu sayın üzərinə daha 18 nəfəri əlavə edə bilib. Saleh bin Abdilaziz əl-Buradi daha on ravini əlavə edərək ümumi sayın 595 olduğunu deyir.[1269] İmam Əhmədin də öz zamanında sahib olduğu şöhrəti onun yanına Əndəlüsdən və Xorasandan tələbələr cəlb edirdi. Lakin bununla belə ondan rəvayət edənlərin sayı heç altı yüzə çatmırdı. Halbuki kufəli şiə ravi əl-Həsən bin Əli əl-Vaşşə deyir ki, "bu məsciddə doqquz yüz şeyx gördüm; onlardan hər biri "Cəfər bin Muhəmməd mənə rəvayət etdi" deyirdi..."[1270]

Kufəli ravilərin arasında Cabir bin Yezid əl-Cufi xüsusi bir yer tutur. Onun haqqında əl-Kəşşi rəvayət edir ki, Zurara deyib: "Əbu Abdilləh'dən - aleyhissələm - Cabir'in hədisləri haqqında soruşdum. Dedi: "Onu atamın yanında yalnız bir dəfə görmüşəm, mənim yanıma isə heç zaman daxil olmayıb."[1271] Bununla belə rəvayətlərdə keçən məlumatlara görə Cabir deyib ki, "mənə əlli min hədis rəvayət olunub ki, onu heç kim məndən eşitməyib." Bir başqa xəbərdə isə deyir: "Mənə Əbu Cəfər - aleyhissələm - yetmiş min hədis rəvayət edib ki, onu heç kimə rəvayət etməmişəm."[1272]Bir başqa ravi Əbən bin Təğləb haqqında isə rəvayət edirlər ki, Cəfər əs-Sadiq deyib: "Əbən bin Təğləb məndən otuz min hədis rəvayət edib, ondan rəvayət edin!"[1273] Əli Muhəmməd Rida Kəşiful-Ğita, əl-Hurr əl-Amili və başqaları Cəfər əs-

---

[1268] İbn Fərhun, "əd-Dibəc əl-Muzhəb", 1/72;

[1269] əl-Buradi, "Təshil əs-Səbilə", 1/397-398;

[1270] "Ricəl ən-Nəcəşi", səh: 40;

[1271] ət-Tusi, "İxtiyər Mərifətir-Ricəl", 2/20; Kitabın mühəqqiqi ravilərinin hamısının siqa olduğunu yazır.

[1272] Eyni məsdər; 2/24-25;

[1273] "Ricəl ən-Nəcəşi", səh: 12;

Sadiq'in tələbələri haqqında və onun tələbələri'nin ondan rəvayət etdikləri haqqında danışdıqlarında bunu fəxrlə qeyd edirlər.[1274] Aydın məsələdir ki, Kufədə yaşamış ravilərin Mədinə şəhərində yaşayıb fəaliyyət göstərmiş birindən bu qədər hədis rəvayət etmələri mümkün deyildir.

Əhlüs-sünnətin kitablarında Cəfər əs-Sadiq'dən hədis rəvayət etmiş ravilərin arasında İsmail bin Cəfər bin Əbi Kəsir əl-Ənsari, Əbən bin Təğləb ər-Rabi, Həsən bin Saleh bin Həy əl-Kufi, əl-Həsən bin Ayyəş bin Səlim əl-Əsədi, Hafs bin Ğiyas, Sufyan əs-Səvri, Sufyan bin Uyeynə, Süleyman bin Bilal ət-Teymi, Şubə bin əl-Həccəc, Abdurrazzəq bin Hummən əs-Sanani, Abdullah bin İdris bin Yezid əl-Əvadi, İbn Cureyc əl-Məkki, Əbu Muhəmməd Abdulvahhab ibn əs-Salt əs-Səqafi, Amr bin Qeys əl-Muləi, Anbəsə bin Nəccəd əl-Abid, Malik bin Ənəs, Əbul-Haris Muhəmməd ibn əl-Muğira əl-Amiri, Məmər bin Raşid əl-Əzdi, oğlu Musa əl-Kazim, Vuheyb bin Xalid əl-Basri, Yəhya bin Said əl-Qattan, Muhəmməd bin İshaq əl-Mədəni, Yezid bin Abdilləh bin Usəmə əl-Leysi kimi siqa və etibarlı ravilərin adları sadalanır. Həmçinin Abdullah bin Dukeyn, Abdulaziz bin Muhəmməd əd-Dəravardi, əl-Hüseyn bin Zeyd əl-Haşimi, Hətim bin İsmail əl-Mədəni, Abdullah ibn Uveys əl-Əsbəhi, əl-Fudeyl bin Süleyman əl-Basri, əl-Qadi Əbul-Yəsir Muhəmməd əl-Harrani, Muhəmməd bin Məymun əz-Zəfərani, Muslim bin Xalid əl-Məxzumi, Musab bin Səlləm əl-Kufi, Yəhya bin Süleym ət-Taifi kimi saduq və hədisləri həsən olan ravilərin də adları keçməkdədir.

Bu hissəni oxuculara ərz etməyimizdəki məqsəd onları maraqlı bir fakt ilə üzləşdirməkdir. İmam Cəfər'in zamanında Mədinə şəhəri əhlüs-sünnət alimləri ilə və onların böyükləri ilə qaynayıb qarışan bir şəhər idi. Yəhya bin Said əl-Ənsari, Musa bin Uqbə əl-Quraşi, Ənəs bin Malik, İbn Əbi Zib, Əbu Abdilləh əl-Məcişun, Muhəmməd bin Aclən əl-Quraşi, Abdulaziz əd-Dəravardi, Əfləh bin Humeyd, məşhur sira kitabının sahibi Muhəmməd bin İshaq və başqaları Mədinə şəhərində yaşayırdılar, sünnəti öyrənir və öyrədirdilər, onların bir çoxu dövrünün böyük fəqihləri olaraq tanınırdılar. Üstəlik Mədinə şəhərinə müsəlman dünyasının fərqli bölgələrindən böyük alimlər gəlib gedirdilər və təbii ki, onlar İmam Cəfər ilə qarşılaşırdılar, çünki Cəfər əs-Sadiq ömrünü Mədinə şəhərində keçirmişdi. Bütün bunlara baxmayaraq bu alimlər

[1274] Bax: Əli Kəşiful-Ğita, "Ədvaru İlm əl-Fiqh va Ətvaruhu", səh: 102; əl-Amili, "Vasəil əş-Şiə", 30/200;

Cəfər əs-Sadiq'i bidətdə ittiham etməyiblər, əksinə onu tərifləyiblər və onun şanını ucaldıblar. Halbuki o dönəmdə ən kiçik xəta belə əfv olunmurdu. İbn Əbi Zib – misal üçün – Mədinə şəhərinin imamı Malik bin Ənəs tək bir hədis ilə əməl etmədiyi üçün küfrdə ittiham etmişdi. İmam Malik isə sira kitabının müəllifi Muhəmməd bin İshaq'ı şiddətli şəkildə tənqid edirdi. Abdurrazzəq əs-Sanani, əl-Aməş, Adiy bin Səbit və başqaları şiəlikdə ittiham olunublar. Lakin İmam Cəfər əs-Sadiqə qarşı belə bir ittihamla əhlüs-sünnət kitablarında rastlaşmaq olmur. Əksinə onun əhlüs-sünnət etiqadına müvafiq bir mövqe sərgilədiyini görürük. Amr bin Qeys deyir: "Cəfər bin Muhəmməd bin Əli'ni belə deyərkən eşitdim: "Əbu Bəkr və Ömərdən bəraət edəndən Allah bəraət etsin!"[1275] Zuheyr bin Müaviyə deyir: "Atam Cəfər bin Muhəmməd'ə dedi: "Mənim bir qonşum var ki, sənin Əbu Bəkr və Ömərdən bəraət etdiyini iddia edir." Dedi: "Allah sənin qonşundan bəraət etsin! Allaha and olsun ki, Əbu Bəkrə olan qohumluğumun mənə fayda verəcəyinə ümid edirəm..."[1276] İmam əz-Zəhəbi kitabında Amr bin Qeys'in rəvayətini gətirdikdən sonra deyir: "Bu söz Cəfər əs-Sadiq'dən mütəvatirdir və mən Allaha şahidlik edirəm ki, o, bu sözündə səmimidir, heç kimin qarşısında münafiqlik etməyib."[1277] Abdulcabbar bin əl-Abbas əl-Həmədəni deyir ki, "onlar Mədinə şəhərindən çıxıb səfər etmək istədiklərində Cəfər bin Muhəmməd onların yanına gəldi və dedi: "Siz - inşallah - öz ölkənizin saleh insanlarındansız. Onlara məndən xəbər çatdırın ki, hər kim mənim itaət olunması fərz olan məsum imam olduğumu deyirsə mən ondan bəriyəm və hər kim mənim Əbu Bəkr və Ömərdən bəraət etdiyimi deyirsə mən ondan bəriyəm."[1278] Səlim bin Əbi Həfsa deyir: "Əbu Cəfər'dən və oğlu Cəfərdən Əbu Bəkr və Ömər haqqında soruşdum. Dedilər: "Ey Səlim! Onları sev və onların düşmənlərindən bəraət et, çünki o ikisi hidayət imamları idilər." Sonra Cəfər dedi: "Ey Səlim, adam da heç öz babasını söyərmi?! Əbu Bəkr mənim babamdır. Mən əgər bu ikisini sevmirəmsə, onların düşmənlərindən bəraət etmirəmsə Allah mənə qiyamət günündə Muhəmmədin şəfaətini nəsib etməsin!"[1279] Həfs bin Ğiyas deyir: "Cəfər bin Muhəmmədi belə deyərkən eşitdim: "Əlinin

---

[1275] Bunu İmam Əhməd şeyxi Əsbət'dən, o da Amr bin Qeys'dən rəvayət edir. Abdullah, "Fədail əs-Sahabə", 1/160 (143)

[1276] İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 2/333 (3212)

[1277] əz-Zəhəbi, "Siyər Əaləmin ən-Nubələ", 6/260; ər-Risələ

[1278] əd-Dəraqutni, "Fədail əs-Sahabə", səh: 88;

[1279] Əhməd bin Hənbəl, "Fədail əs-Sahabə", 1/175;

şəfaətindən arzu etdiyim elə bir şey yoxdur ki, onun eynisini Əbu Bəkrin şəfaətindən arzu etməyib. O mənim iki yerdən atamdır."[1280] Urva bin Abdilləh deyir: "Əbu Cəfər Muhəmməd bin Əli'nin yanına gəldim və dedim: "Qılıncları bəzəmək haqqında nə deyirsən?" Dedi: "Bunda bir bəis yoxdur; Əbu Bəkr əs-Siddiq öz qılıncını bəzəyib." Dedim: "Sən də əs-Siddiq deyirsən?" Bu zaman dərhal sıçradı, qibləyə tərəf üz tutdu və dedi: "Bəli, əs-Siddiq! Bəli, əs-Sİddiq! Bəli, əs-Siddiq! Hər kim ona əs-Siddiq deməkdən imtina edərsə Allah onun bu dünyada və axirətdə sözünü təsdiqləməsin!"[1281] "əs-Sira" kitabının müəllifi Muhəmməd bin İshaq deyir: "Əbu Cəfər Muhəmməd bin Əli dedi: "Əbu Bəkr və Ömərin fəzilətini tanımayan sünnətdən cahildir."[1282] Bütün bu nəqllər Cəfər əs-Sadiq və atası Muhəmməd əl-Baqir'in insanlara - ən azından əhlüs-sünnətə - öyrətdikləri etiqadın məhz sünnət etiqadı olduğunu göstərir. O zaman burada iki ehtimal ola bilər. Ya Cəfər əs-Sadiq şiələrin dedikləri kimi zahirdə təqiyyə edərək sünnət əhli cildində yaşadığı halda batində imamiyyə şiələrinin etiqadına inanan biri olub. Ya da o, zahirən də, batinən də eyni etiqadda olub və zahirdə dediklərinə batində etiqad edən biri idi və ona nisbət edilən inanclar isə əslində Kufə əhlinin onun adından uydurduqları batil etiqadlar olub. Şiələr birinci ehtimala inandıqları halda sünnət əhli ikinci ehtimalın doğru olduğunu deyirlər. Çünki birinci ehtimal nəinki ümmətin içindən seçilmiş imamlara, insanların üzərinə təyin edilmiş höccətlərə heç ümumiyyətlə özünə hörmət qoyab və mürvət sahibi heç kimə yaraşdırılacaq bir xüsusiyyət deyildir. Çünki belə bir şey iddia etməyin tələb etdiyi yeganə nəticə budur ki, İmam Cəfər əs-Sadiq zahirdə sünnət əhlinə müvafiq etiqadları öyrətməklə cumhurun "zəlalətini" təsdiqləmiş və onlara "batil" inanclar öyrətmiş olub. Allahın insanlar üçün hidayət rəhbəri olaraq seçdiyi şəxslər haqqında necə belə bir şeyə inanmaq mümkündür?!

[1280] əd-Dəraqutni, "Fədail əs-Sahabə", səh: 57;
[1281] Əhməd bin Hənbəl, "Fədail əs-Sahabə", 1/419;
[1282] əd-Dəraqutni, "Fədail əs=Sahabə", səh: 59;

# İmamlara aparan isnadlar

Bütün bunları bildikdən sonra imamların "əshabı" deyə bizə tanıdılan şiə ravilərinin halına nəzər salaq. Onlar bizə doğru dini öyrədəcək dərəcədə keyfiyyət və dəqiqlik nümayiş etdiriblərmi? Şiələrdəki müasir əxbari məktəbinin banisi Muhəmməd Əmin əl-Əstrabadi qeyd edir ki, Cəfər əs-Sadiq'dən "dörd minə yaxın ravi (hədis) rəvayət edib və onun təlimi ilə, Zurara bin Ayun, iki qardaşı Bukeyr və Həmran, sonra Cəmil bin Dərrac, Muhəmməd bin Muslim, Bureyd bin Muaviyə, iki Hişam, Əbu Bəsir, Ubeydullah, Muhəmməd və İmran əl-Hələbi, Abdullah bin Sinan, Əbus-Sabah əl-Kinəni və fəzilətlilərin böyüklərindən olan digərləri kimi çox sayda fəzilətli fəqihlər çıxdı, ta ki, Cəfər əs-Sadiqin suallara verdiyi cavablarından dörd yüz müəllifin dörd yüz kitabı yazıldı və buna "üsul" adını verdilər." əl-Əstrabadi'nin burada zikr etdiyi "üsul" kitablar şiələrdə "dörd yüz üsul" olaraq tanınır. Onun bu həddindən çox optimistik olan təsvirinə üsuli məktəbinin nümayəndələrindən Nuruddin əl-Amili belə cavab verir: "Onun fəzilətlilər olaraq zikr etdiyi kəslərin əksəriyyəti haqqında öz imamlarından varid olmuş və onları ayıblayan hədislərin çoxluğunu görən kəs uydurulmuş hədislərin hələ o zaman nə qədər çox olduğunu anlayacaq, biz hələ digər zamanları demirik! Bu uydurma rəvayətlər o qədər çoxdur ki, onları təqiyyə ilə izah etmək mümkün deyildir. əl-Kəşşi'nin kitabında əl-Feyd bin əl-Muxtar (İmam) Əbu Abdilləhdən - aleyhissələm - rəvayət etdiyi hədisdə ona deyir: "Allah məni sənə fəda etsin! Sənin şiələrin arasındakı bu ixtilaf nədir?" Soruşdu: "Ay Feyd, hansı ixtilaf?" əl-Feyd ona dedi: "Mən onların Kufədəki halqalarında otururam və onların ixtilaflarına görə (rəvayət etdikləri) hədislərdə az qala şəkk edirəm ta ki, əl-Mufəddal bin Ömərə müraciət edirəm, beləliklə o məni bunlardan nəfsimin rahatlıq tapdığı, qəlbimin xətircəm olduğuna yönəldir." Əbu Abdilləh bunun üzərinə dedi: "Bəli, vəziyyət sənin dediyin kimidir, ey Feyd! İnsanlar bizim adımızdan yalan uydurmağı çox sevirlər… Mən onlardan birinə bir hədis danışıram, mənim yanımdan çıxar çıxmaz onu qəsd etdiyim mənadan başqa mənaya həml edir. Səbəbi isə budur ki, onlar bizim hədislərimiz ilə Allah rızasını istəmirlər, sadəcə olaraq dünyaya nail olmaq istəyirlər…" Biz bu hədisi yalnız ona görə nəql etdik ki, o vaxtdan bəzi zəif hədislərin çoxluğu, (səhih hədislərə) qarışmış halda olmağı, onları bir-birindən

ayırmağa və onları araşdırmağa ehtiyacın olduğu bilinsin!”[1283] Buradan anlaşılır ki, şiələrin “dörd yüz üsul” adlandırdıqları qaynaqlar - ən yumşaq dildə desək - problemsiz deyildir. Bu yalnız yumşaq dillə verdiyimiz qiymətdir, həqiqəti tam çılpaqlığı ilə izah etmək mümkn deyildir. Dəqiq onu demək mümkündür ki, bu “üsul” deyilən qaynaqlar bizə imamların mirasını çatdırmaqdan acizdir. Ona görə də bu isnadlara əsasən imamların təlimlərinin nə olduğunu yəqinliklə demək mümkün deyildir. Şiə alimlərindən Hüseyn bin Şihəbuddin əl-Kərki əl-Amili (vəfatı h. 1076) “imamların tələbələri onlardan üsul və furunu yəqinlik ifadə edən yollarla öyrənə biliblər” deyəndə bu iddiaya üsuli şiələrdən olan Şeyx Murtəda əl-Ənsari (vəfatı h. 1281) belə cavab verir: “Sonra onun - “imamların əshabı üsulu və furunu yəqin yollarla öyrənə biliblər” - deməsinə gəldikdə isə bu, mümkün olmayan bir iddiadır, mümkün olmamağı aşkardır. Buna şahidlik edən ən kiçik dəlil, imamların tələbələrinin üsulda və furuda etdikləri ixtilaflardır ki, bunlara həm göz, həm də tarix şahiddir. Buna görə də onların əshabından bir çoxu imamlara onların tələbələri arasındakı ixtilafdan şikayət edirdilər. Bəzən - Hariz, Zurara və Əbu Əyyub əl-Xazzəz’in rəvayətlərindəki kimi - verdikləri cavab bu idi ki, ixtilafı imamlar özləri onların arasına salıblar ki, onların qanlarını qorusunlar. Bəzən də - əl-Feyd bin Muxtar’ın rəvayətindəki kimi - bu ixtilafın yalançı ravilərdən qaynaqlandığını deyərək cavab veriblər. (əl-Feyd) deyir: “Əbu Abdilləhə dedim: “Allah məni sənə fəda etsin, sizin şiələriniz arasındakı bu ixtilaf nədir?” Dedi: “Hansı ixtilaf, ey Feyd?” Ona dedim: “Mən Kufədə onların halqalarında otururam və az qala onların ixtilaflarına görə hədislərində şəkk edirəm ta ki, əl-Mufəddal bin Ömərə müraciət edirəm, beləliklə də o məni nəfsimin rahatlıq tapdığına yönəldir.” Dedi: “Bəli, sənin dediyin kimidir, ey Feyd. Şübhəsiz ki, insanlar bizim adımızdan yalan danışmağa həvəslidirlər, sanki Allah onlara bundan başqa bir şeyi fərz etməyib. Mən onlardan birinə bir hədis rəvayət edirəm, o isə yanımdan çıxar çıxmaz onu öz mənasından başqa mənaya həml edir. Çünki onları bizi hədisimizlə, bizi sevdiklərini deməklə Allahın razılığını əldə etmək istəmirlər, onların hər biri lider olmaq istəyir.” Buna yaxın rəvayət Davud bin Sərhan’dan gəlir. Qumilərin “Nəvadirul-Hikmə” kitabından xeyli ravini istisna etmələri məşhurdur və İbn Əbil-Avcənin hekayəsi - yəni onun edam zamanı “mən sizin kitablarınıza dörd min hədis salmışam” deməsi - ricəl kitablarında qeyd olunur. Yunus bin

---

[1283] “əl-Fəvaid əl-Mədəniyyə va bi Zeylihi əş-Şəvahid əl-Məkkiyyə”, səh: 168-169; Muəssəsətu ən-Nəşr əl-İsləmi, Qum, 1426

Abdirrahmən'in zikr etdiyi də bura aiddir ki, o, əl-Baqir və əs-Sadiqin tələbələrinin xeyli sayda hədisini toplamış, sonra onları Əbul-Həsən ər-Rida'ya ərz etmiş, o da ordan çox sayda hədisi inkar etmişdir." Bunun kimi bir çox rəvayətlər vardır ki, onun (yəni əl-Kərki'nin) dediyinin əksinə şahidlik edir."[1284] Biz əgər imamların zamanına qayıtsaq görərik ki, imamlar onların adından yalanların yayıldığını bilirdilər, xəbərlər çatırdı, lakin buna qarşı aciz idilər və bunun qarşısını almaq üçün yalançılardan bəraət edirdilər. Bu mövzularda haqqı bəyan etməkdən başqa bir şey etmək əllərindən gəlmirdi.

Burada maraqlı olan məqam budur ki, şiələrdə "əshabul-icma" olaraq tanınan Zurara bin Ayun, Məruf bin Xarrabuz, əl-Fudeyl bin Yəsar, Bureyd bin Müaviyə, Muhəmməd bin Muslim ət-Taifi, Əbu Bəsir əl-Əsədi kimi ravilər, həmçinin Cabir əl-Cufi, Əbən bin Təğləb, Muhəmməd bin Əli bin ən-Numən, Əbu Həmzə əs-Suməli, Abdullah bin Aclən kimi məşhurlar beşinci imam əl-Baqir'dən çox sayda hədis rəvayət edirlər. Lakin Zərih əl-Muharibi bizə Cəfər əs-Sadiq'in belə dediyini rəvayət edir: "Atam necə də gözəl bir ata idi! Allah ona rəhmət etsin! Həmişə deyərdi: "Əgər elmi əmanət edəcəyim və elmin əhli olan üç nəfər olsaydı onlara elə şeylər rəvayət edərdim ki, məndən sonra Qiyamət gününə qədər halal və haram məsələsində başqa şeyə baxmağa ehtiyac qalmazdı."[1285] Belə çıxır ki, "əshabul-icma" olaraq tanınan bu şəxslər əl-Baqir'in nəzərində elmə əhliyyəti olmayan, əmanətə vəfası olmayan kəslərdir, halbuki bu şəxslərin hər birinin əl-Baqir və əs-Sadiqdən minlərlə rəvayətləri vardır. Cəfər əs-Sadiq'dən rəvayət edən ravilərin çoxluğu özlüyündə sual doğurur. əl-Mufid deyir: "Alimlər onun əhlu-beytindən heç kimdən ondan nəql etdikləri qədər nəql etməyiblər… Hədis alimləri ondan rəvayət etmiş siqa ravilərin adlarını toplayıblar… və sayları dörd min nəfərə çatıb."[1286] Dörd min ravi bir alim üçün fantastik bir rəqəmdir. Əhlüs-sünnət alimləri içərisində bu sayın yarısına belə çatacaq heç bir imam və fəqih tanınmır. əs-Suyuti "əl-Muvatta" kitabının şərhində yazır ki, "Malikdən rəvayət edənlər çoxdur, beləki imamlardan heç birinin onun raviləri qədər raviləri olduğu bilinmir.."[1287] Daha sonra isə qeyd edir ki, əl-Xatib əl-Bağdadi bu barədə ayrıca kitab yazıb və orada Malikdən rəvayət edənlərin hamısını saymağa çalışıb, lakin yalnızca 993 ravi

---

[1284] əl-Ənsari, "Fəraidul-Usul", 1/325-326;

[1285] əs-Saffər, "Bəsair əd-Dəracət", səh: 498; Muəssəsətul-Aləmi, Tehran, 1404

[1286] əl-Mufid, "əl-İrşad", 2/179;

[1287] əs-Suyuti, "Tənvirul-Həvalik Şərh Muvatta Malik", 1/10-11;

saya bilib. əl-Qadi İyad isə bu barədə yazdığı kitabda ən uzağı təxminən 1300 ravi olduğunu saya bilib. Necə olur ki, İmam Malik kimi səsi-sorağı Əndəlüsə qədər gedib çıxmış bir imamdan rəvayət etmiş zəif və siqa ravilərin sayı 1300-ə güclə çatdığı halda Cəfər əs-Sadiq kimi daha qapalı bir mühitdə fəaliyyət göstərən alimdən 4000 siqa ravi hədis rəvayət edə bilir?! Bu əgər bir şeyi sübut edirsə yalnız və yalnız Cəfər əs-Sadiq'in adından yalan uyduran ravilərin çoxluğunu sübut edir.

İddiaya görə şiələrin "əl-Kəfi" kimi hədis kitabları öz materiallarının bir hissəsini bu dörd yüz "üsuldan" götürüb. Bu dörd yüz üsul haqqında şiələrdə tam və dolğun heç bir məlumat yoxdur. Nəcmuddin əl-Hilli yazır ki, Cəfər əs-Sadiq'dən "dörd minə yaxın insan rəvayət edib, onun təlimi ilə fəzilət sahibi fəqihlər yetişdi … və onun suallara verdiyi cavablardan dörd yüz kitab yazdılar, adını "üsul" qoydular."[1288] ət-Tabrasi isə deyir: "İmam əs-Sadiq'dən - aleyhissələm - elm əhlinin məşhurlarından dörd min insan rəvayət edib və onun suallara verdiyi cavablardan dörd yüz kitab yazılıb ki, buna üsul deyilir. Bunu onun və oğlu Musa əl-Kazım'ın tələbələri rəvayət ediblər."[1289] əş-Şəhid əs-Səni də deyir ki, "keçmiş alimlərin əməyi dörd yüz müəllifin yazdığı dörd yüz kitab üzərində istiqrar etdi, onu "üsul" adlandırdılar və etimad etdikləri qaynaqlar onlar idi."[1290] Belə başa düşülür ki, bu dörd yüz üsulun müəllifləri Cəfər əs-Sadiq'in tələbələri olub. ət-Tabrasi'nin sözündən anlaşılan isə budur ki,onların bir hissəsi İmam əl-Kazım'ın tələbələri olub. əl-Mufid'dən gətirilən nəqlə görə isə "imami şiələri möminlərin əmiri (Əli)nin - aleyhissələm - zamanından Əbu Muhəmməd əl-Askəri'nin - aleyhissələm - zamanına qədər dörd yüz kitab yazıblar; bunlar "üsul" adlanırlar."[1291] Bu sözlərdən başa düşülən məna isə budur ki, bu dörd yüz kitabın müəllifləri təkcə Cəfər əs-Sadiq'in tələbələri olmayıb, daha erkən bir dönəmdən yazılmağa başlayıb. Bu gün bu "üsul" adlandırılan hədis kitabçaları bizim zamanımıza gəlib çatmayıb. Abdu Əli Al Usfur əl-Bəhrani bu "üsul" haqqında yazır: "… onların kitablarının özü qalmayıb, əksinə xeyli hissəsi tələf olub. Onlardan geriyə qalmış az bir hissəsi isə bizə yalnız ya fətəhilərin, ya vaqifilərin, ya yalançılar və hədis uyduranların nəqli

[1288] əl-Hilli, "əl-Mutəbər fi Şərh əl-Muxtəsar", 1/26;

[1289] ət-Tabrasi, "İləmul-Vara bi Aləm əl-Hudə", səh: 166;

[1290] ət-Tehrani, "əz-Zəriah", 2/131;

[1291] bax: Muhsin əl-Əmin, "Ayənuş-Şiə", 1/140; Cəfər əs-Subhəni, "Kulliyyət fi İlm ər-Ricəl", səh: 483;

ilə gəlib çatıb.."[1292] Bir səhifə sonra sözlərini daha da dəqiqləşdirir və yazır ki, "bu üsul kitablarının özü o üç böyük şeyxin zamanına qədər gəlib çatmamışdı, əksinə onların xeyli hissəsinin tələf olduğu bilinir və yerdə qalanlardan onlara çatanlar ya müxaliflər, ya fasiqlər vasitəsilə çatıb, ya da oradakı rəvayətlərdə ixtilaflar edilib…"[1293] O üç böyük şeyx ilə qəsd etdiyi əl-Kuleyni, əs-Saduq və Şeyxut-Taifə ət-Tusidir. Bu üsul kitabçalarının sahibləri haqqında da doğru-düzgün məlumat yoxdur. Şiə alimi Muhəmməd Təqi əl-Məclisi yazır ki, "sən əgər ricəl kitablarını incələsən görəcəksən ki, dörd yüz üsulun müəlliflərinin əksəriyyəti haqqında nə tədil, nə də cərh mövcud deyildir."[1294]

Şiələrin ən məşhur hədis kitabı sayılan "əl-Kəfi" kitabının müəllifi əl-Kuleyni "kiçik qeybət" dönəmində, yəni on ikinci imamın zamanında, onun dörd səfirinin zamanında yaşayıb və ömrünün iyirmi ilini - imami şiələrinin iddiasın görə - "əl-Kəfi" kitabının rəvayətlərini toplamağa həsr edib. Bu müddət ərzində onun qarşısına qoyduğu məqsəd məsum imamlardan gələn səhih rəvayət mirasını şiələrə təqdim etmək, onları sünnilərin rəvayətlərindən və "zəlalətlərindən" qorumaq olub. Nə üçün əl-Kuleyni bir başa İmam əl-Askərinin özündən rəvayət etməyib, halbuki zaman və məkan baxımından yaxın olublar? On birinci imam əl-Həsən əl-Askəri hicri 232-ci ildə anadan olub və 260-cı ildə vəfat edib. Muhəmməd bin Yaqub əl-Kuleyni isə təxminən hicri 255-ci ildə anadan olub. əl-Kuleyni'nin İmam əl-Askəri'nin tələbələrini axtarıb tapmaq və onlardan hədislər rəvayət etmək imkanı olub, lakin bunu etməyib. Daha da qəribə olan budur ki, İmam Mehdi'nin naibləri olduğu iddia edilən şəxslərlə eyni şəhərdə yaşamağına baxmayaraq onlardan da birbaşa heç bir rəvayət gətirmir. Bütün bunlar əl-Kuleyni'nin rəvayət metodu barəsində ciddi sual işarələri doğurur və onun etibarlılığını şübhə altına alır.

Hurr əl-Amili yazır: ""Bunun eynisi - icma əshabı kimi - etibarlı, mötəbər ravilərin və bənzərlərinin zəiflərdən, yalançılardan, məchullardan rəvayətlərində də keçərlidir; beləki onların hallarını bilirlər, onlardan rəvayət edirlər, onların hədisləri ilə əməl edirlər və onların səhihliyinə şahidlik edirlər. Xüsusilə də rəvayət yollarının çoxluğunu bilməklərinə, onlardakı səhih əsllərin çoxluğuna, (o yalançılardan rəvayət etdiklərini) həmin əsllərə, hətta imamlara -

---

[1292] Al Usfur, "İhyə Məalim əş-Şiə bi Əxbər əş-Şəriə", 1/76;

[1293] Eyni mənbə, 1/77-78;

[1294] əl-Məclisi, "Ravdatul-Muttəqin", 1/197;

aleyhimussələm - ərz etmək imkanlarının olmasına baxmayaraq (o zəiflərdən, yalançılardan və məchullardan rəvayət ediblər). Onların bu etdiklərini və (həmin rəvayətlərin) səhihliyinə şəhadət etməklərini doğru şəkildə izah etmək lazımdır ki, onlara tənə edilməsin. Yoxsa əks təqdirdə zəiflikləri və yalanları aşkar olduğu üçün onların rəvayət etdiklərinin hamısının zəif olması nəticəsi ortaya çıxır, beləliklə də yeni hədis elmi doğru olmaz..."[1295] əl-Amili şiə ravilərinin bilərəkdən yalançılardan, məchullardan hədislər rəvayət etdiklərini qeyd edir. əş-Şərif əl-Murtəda burada bir başqa reallığa diqqət çəkir və yazır: “Şübhəsiz ki, fiqhin əksəriyyətinin, çoxunun, hətta hamısının istinadı vaqifi məzhəbində olanlardan xali deyildir; ya (rəvayət olunan) xəbərlərdə ilk ravi onlardır, ya da fər’ olaraq ravi kimi başqasından rəvayət edirlər. Bu istinadlar aşırılara, xəttabilərə, hülul etiqadında olanlara, çoxluqlarına görə adlarını çəkə bilmədiyimiz fılankəs və fılankəsə dayanır. Həmçinin təşbih və cəbr etiqadında olan qumlulara da dayanır və qumluların heç birinə istisna qoymadan - yalnız Əbu Cəfər bin Bəbəveyh müstəsna - hamısı dünən təşbih və cəbr etiqadında idilər və onların yazıları və kitabları buna şahidlik edir, bunu dilə gətirir. Heyrət! Görəsən hansı rəvayətin əsli və fəri vaqifi, aşırı və ya müşəbbih, mucbir olan qumi ravidən salamatdır?!”[1296]

İmamların elminə yetişmək üçün, onları öyrənmək üçün “isnad elmi” çox önəmlidir. Şiə alimləri özləri etiraf edirlər ki, hökmlərin istinbatı və üsul üzərində furu bina etməyin mümkünlüyü isnad elmindən asılıdır. Şihəbuddin əl-Məraşi ən-Nəcəfi yazır ki, “islam elmlərinin ən şərəflilərindən biri dirayət elmidir və o, ricəl elminə giriş mərtəbəsində bir elmdir. Hər iki elm hədis elmlərinin ən əhəmiyyətlilərindəndir, hökmləri istinbat etmək, furuatı üsula qaytarmaq bu elmlərin ətrafında dövr edir.”[1297] Buna baxmayaraq şiələrdə hədislərin yazıldığı və toplandığı ən əsas dönəmdə hədis elmi formalaşmamışdı və bu barədə xüsusi kitablar təlif edilməmişdi. Şiə alimlərinin öz yazdıqlarına inanmalı olsaqhicri 966-cı ildə vəfat etmiş əş-Şəhid əs-Səni ləqəbli Zeynuddin əl-Amili bu sahədə kitab qələmə almayana qədər şiələrdə bu elmlə bağlı xüsusi bir kitab yazılmamışdı. əl-Hurr əl-Amili bu alim haqqında yazarkən deyir ki, “imami şiələri arasından hədis dirayətində ilk dəfə kitab yazan odur, lakin terminləri

[1295] əl-Amili, “Vasəiluş-Şiə”, 30/206;

[1296] əl-Murtəda, “Rasəil əş-Şərif əl-Murtəda”, 3/310; Dar əl-Quran əl-Kərim, 1405, Qum

[1297] “Şərh əl-Bidəyə” kitabının müqəddiməsi, səh: 9; Abdulhüseyn Muhəmməd Əli əl-Bəqqal’ın təhqiqi ilə

sünnilərin kitablarından nəql edib - necəki bunu oğlu və başqaları qeyd ediblər."[1298] Digər şiə alimi Hüseyn bin Şihəbuddin əl-Kərki isə yazır: "İmami şiələrin dirayət elmində kitabı olmayıb… Dirayətdə əshabımızdan ilk dəfə kitab yazan əş-Şəhid əs-Səni olub, şafi alimi İbnul-Salah'ın dirayətdə yazdığı kitabı ixtisar edib…"[1299] İmami alimlər ittifaq edirlər ki, şiələrdəki dördlü bölgü, yəni hədislərin səhih, həsən, muvassəq və zəif olaraq dörd qismə bölünməsi ilk dəfə - ən məşhur rəyə görə - İbnul-Mutahhar əl-Hilli (h. 726) və ya şeyxi Əhməd bin Tavus (h. 673) tərəfindən başladılıb; bundan əvvəl imami şiələrində belə bir bölgü yox idi və bilinmirdi. əl-Hilli'dən sonra şiələrin üsuliləri bu təqsimə tabe oldular. Lakin bu yeni təqsim şiə alimləri arasında birmənalı qarşılanmadı. Əxbari qoluna mənsub olan şiələr bu təqsimə riayət edildiyi təqdirdə şiələrin xəbərlərinin böyük əksəriyyətinin etibardan düşəcəyinə diqqət çəkdilər. əl-Hurr əl-Amili deyir ki, "daha yaxından öyrənildikdə" bu dördlü bölgü "hədislərin hamısının zəif olmasını gərəkdirir, çünki onlara görə səhih hədis, bütün təbəqələrdə adil və zəbt sahibi imami şiəsi olan ravilərin rəvayət etdikləridir və ravilərdən heç kimin - nadir olanlar müstəsna - adil olduğunu deməyiblər…"[1300] əl-Bəhrani isə qeyd edir ki, hədisləri bu cür təsnifləndirmək şəriətin çökməsinə gətirib çıxarır, çünki "səhih və həsən olan hədislər əhkamdan yalnız az bir hissəsini qarşılayır…" əl-Bəhrani qeyd edir ki, əl-Kafi kitabının əksəriyyəti onların təsnifinə görə zəif hədislərdir. Ona görə də o, yalnız iki yolun olduğunu deyir: "Vacib olan ya qədimdəki saleh alimlərimizin etdikləri kimi xəbərlər(in hamısı) ilə əməl etməkdir, ya da bu dindən başqa bir din, bu şəriətdən başqa bir şəriət seçməkdir.." Çünki əl-Bəhrani'yə görə hədisləri bu cür kritik analizə tabe tutmaq şəriətin naqis olduğunu göstərəcək, ona görə də burada "üçüncü variant yoxdur."[1301] Bu şiə aliminin burada "din" və "şəriət" ilə qəsd etdiyi şiələrin inanclarına və fətvalarına müvafiq olan din və şəriəti qəsd edir, beləki sünniliyi seçən - əl-Bəhrani'yə görə - başqa bir dini, başqa bir şəriəti seçmiş olur.

Bu həqiqətlər səbəbindən bir çox şiə alimi rəvayətlərin isnadlarını incələməyi mənasız bir iş hesab edirlər. Onlara görə bu hədis kitablarını yazanlar içindəki hədislərin etibarlı olduğunu qəsd edərək yazıblar və ona görə də müasir zamanımızda da onları etibarlı sayaraq onlara əməl

---

1298 əl-Hurr əl-Amili, "Əməlul-Əmil", 1/86; Muəssəsətul-Vafə, Beyrut, 1983

1299 əl-Kərki, "Hidayətul-Əbrar", səh: 104; Muəssətu Əhyə əl-Əhyə

1300 əl-Hurr əl-Amili, "Vasəiluş-Şiə", 20/101;

1301 əl-Bəhrani, "Lu'lu'ətul-Bəhreyn", səh: 46-47;

etmək lazımdır. Bəzi alimlər isə bütün xəbərləri qəbul etməsə də tamamilə başqa bir üslub ilə isnadları araşdırmaqdan yayınır. Şiə alimi Mirzə Əbul-Həsən əş-Şərani yazır: "Bu kitablarla bağlı mənim tərzim ravilərin hallarına baxmaq deyil, çünki bu kimi araşdırmalar isnadları öyrənməyə ehtiyac qoymur, burada etimad olunan şey mənadır. Beləliklə də məzhəbin təməl prinsiplərinə və əqlin dəlilinə müvafiq olarsa - isnadı zəif olsa belə - o səhihdir və bu ikisinə müxalif olarsa - isnad baxımından səhih olsa belə - zəifdir. Ona görə də (əl-Kuleyni'nin ) "Usulul-Kəfi" kitabındakı hədislərin əksəriyyəti zəifdir…"[1302] Daha bir şiə alimi Əli Tabətabai əl-Burrucurdi etiraf edir ki, "bu hədis kitablarına alınmış səhih hədislər, qara iynək üzərindəki ağ bir tük kimidir."[1303]

---

[1302] əl-Məzəndərani, Haşiyətu "Şərh Usul əl-Kəfi", 3/228;
[1303] "Taraiful-Məqal", 2/308;

# İMAMƏT VƏ TARİX

Kitabımızın bu hissəsində imamət inancının tarixi perspektivdə necə formalaşmış olduğuna baxmağımız lazımdır. Çünki bir məzhəbin və etiqadın haqqaniyyət iddiasındakı doğruluq payı onun köklərinin dərinliyi ilə yoxlana bilər, beləki həqiqi İslam dini şübhəsiz ki, İslam peyğəmbərinin öyrətdiyi təlimlərdən fərqli ola bilməz. Allahın elçisinin – salləllahu aleyhi va səlləm – zamanında doğru olan bir inanc heç bir şəkildə bu gün də doğru ola bilməz. Onun zamanında din haqqında mövcud olmayan təsəvvür bu gün onun adından doğru bir təsəvvür kimi təbliğ edilə bilməz. Bəzi inancların tarixi mərhələlər keçməklə əmələ gəldiyini və müəyyən bir qrupun zehnində kök atdığını görmək bu inancların yeniliklər olduğunu, dinə daxil olmuş yad ünsürlər olduğunu deməyimizə imkan verir. Ona görə də burada hamıdan əvvəl imami şiələrin öz kitablarındakı, sonra isə digər firqələrin kitablarındakı məlumatlara əsaslanaraq bu inkişaf xəttini bacardığımız qədər canlandırmağa çalışacağıq. Bunun üçün bəzi məqamlarda zamanın axarının əksinə doğru tarixin dərinliyinə qədər, ilk şiələrin formalaşdığı zamana qədər səyahət edəcəyik.

Biz bu bölmədə şiəliyin bir məzhəb olaraq nə zaman ortaya çıxdığını öyrənməyi qarşımıza məqsəd qoymamışıq, çünki bu barədə ciddi bir fikirayrılığı var. Şiələr əlbəttə ki, bunun hələ Allahın elçisinin – aleyhissalətu vassələm – zamanında mövcud olduğunu iddia edirlər. Lakin sünnət əhlinin alimləri və əksər müstəşriqlər bu məzhəbin ilk cücərtilərinin Allahın elçisinin vəfatından sonrakı dövrə təsadüf etdiyini deyirlər. Əlbəttə ki, bununla nəzərdə tutulan şiəlik günümüzdəki şiəlik deyildir, əksinə buradakı şiəlik ilə daha çox siyasi məsələlərdə Əli bin Əbi Talib'in tərəfini tutmaq qəsd olunur. Bu mənada Əbu Sufyan belə şiə hesab oluna bilər, çünki Əbu Bəkrin simasında teymilərin hakimiyyətə gəlməsindənsə Əlinin simasında haşimilərin hakimiyyətə gələrək Qureyşdəki ierarxiyanın qorunmasının tərəfdarı idi. Əgər Səqifə hadisələrindən sonra çıxan şiəlik siyasi xarakter daşıyırdısa artıq

Əlinin xəlifə seçildiyi dönəmdə şiəlik etiqadi xarakter almağa başladı. Bu dönəmdə artıq Əbu Bəkr və Öməri söymək bidəti ortaya çıxdı və Əlinin Peyğəmbərin – aleyhissələm – vasisi olması iddiası ortaya atıldı. İbn Əbi Xeysəmə səhih isnadla rəvayət edir ki, Zeyd bin Vəhb deyib: "Əli dedi: "Mənim bu qara tuluğla nə işim var? Abdullah bin Səba'nı qəsd edirdi və o, Əbu Bəkr və Ömərə dil uzadardı." Bir başqa isnadla rəvayət edir ki, Huceyyə əl-Kindi dedi: "Əlini minbər üstündə gördüm və o belə deyirdi: "Kim məni Allahın adından yalan danışan bu qara tuluğdan qurtarar?! Bununla İbnus-Səvda'nı qəsd edirdi." Yenə bir isnad ilə Əbut-Tufeyl'in belə dediyini rəvayət edir: "əl-Museyyəb bin Nəciyyə'ni onu – yəni İbnus-Səvda'nı – boynundan tutaraq gətirdiyini gördüm. O zaman Əli minbərdə idi. Bunun üzərinə dedi: "Onun məsələsi nədir?" Dedi: "Allahın və Rasulunun – salləllahu aleyhi va səlləm - adından yalan danışır."[1304] Bu səhih xəbərlərdən sabit olur ki, Əli bin Əbi Talib'in xəlifəliyi dönəmində müəyyən bir şəxs Allahın və Rasulunun adından yalan danışaraq təhlükəli iddiaların sahibi olub və ona görə də Əli minbərdə ikən boynundan tutularaq qarşısına çıxarılıb. Rəvayətdən həmçinin anlaşılır ki, bu şəxsin adı Abdullah bin Səba olub və bəzən ona İbnus-Səvda da deyilib.[1305] Belə görünür ki, Abdullah bin Səba və onu izləmiş bir camaatın şiəlik olaraq vəsf edə biləcəyimiz bir məzhəbləri olub. Bu firqə hələ erkən zamanda "səbəiyyə" firqəsi olaraq tanınıb və erkən zamanda belə bir firqənin varlığı qaynaq kitablarda öz əksini tapır. Yaqub bin Sufyan əl-Fəsəvi "əl-Mərifə vat-Tarix" kitabında deyir: "Sufyan bizə rəvayət etdi; əz-Zuhri bizə rəvayət etdi; dedi: Muhəmməd bin Əli'nin iki oğlu Həsən və Abdullah – və Həsən (rəvayətdə) Abdullahdan daha qaneedici idi və Abdullah "səbəiyyənin" hədislərini toplayardı – bizə atalarından rəvayət etdilər ki, Əli İbn Abbasa dedi: "Sən azmış bir adamsan! Həqiqətən Allahın elçisi – salləllahu aleyhi va səlləm – Xeybər günü həm mutə nikahını, həm də ev eşşəklərinin ətini qadağan etdi. Mutə nikahı(nın halal olmasına) fətva

---

1304 İbn Əbi Xeysəmə, "ət-Tərix əl-Kəbir", 3/177 (4358, 4359, 4360)

1305 Burada İbn əs-Səvda sözü sadəcə olaraq "qara qadının oğlu" deməkdir. Abdullah bin Səba'nın əslən Yəməndəki yəhudilərdən, etnik olaraq isə həbəşi olduğunu deyən tarixçilər İbnus-Səvda ilə İbn Səba'nın eyni şəxs olduğunu deyirlər. İbn Əbi Xeysəmə'nin də rəvayətlərindən eyni məna başa düşülür. İbn Cərir ət-Tabəri və əksər tarixçilər onları eyni şəxs hesab edirlər. Lakin Əbul-Muzaffər əl-İsfəraini'nin "ət-Təbsira fid-Din" kitabında (səh: 124) və Abdulqahir əl-Bağdadi'nin "əl-Fərq Beynəl-Firaq" kitabında (səh: 225) dedikləri sözlərindən anlaşılan budur ki, İbnus-Səvda və İbn Səba iki fərqli şəxsiyyətdir. Doğru olan və rəvayətlərdən anlaşılan budur ki, eyni şəxsiyyətdir, sadəcə olaraq dərisinin qaralığına görə "qara qadının oğlu" ləqəbi ilə çağırılıb.

verməǃ"[1306] Həmçinin İmam əl-Buxari deyir: "Əli dedi: (Sufyan) bin Uyeynə bizə rəvayət etdi; əz-Zuhri rəvayət etdi; əl-Həsən bizim nəfsimizdə o ikisindən ən siqa olan idi və Abdullah isə "əs-Səbəiyyə" (firqəsi)ni araşdırardı."[1307] Bu səhih xəbərdan anlaşılır ki, Muhəmməd bin əl-Hənəfiyyə'nin oğlu, yəni mömінlərin əmiri Əli bin Əbi Talib'in nəvəsi Abdullah bin Muhəmməd bin Əli "Səbəiyyə" firqəsinin xəbərlərini toplayardı. Həmçinin İbn Cərir ət-Təbəri yazır: "əl-Həsən bin Yəhya bizə rəvayət etdi; dedi: Abdurrazzəq bizə rəvayət etdi; dedi: Mə'mər (bin Raşid) bizə Qatədə'dən xəbər verdi ki, o, Allahın "Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın arcınca düşərlər" sözü haqqında belə deyərdi: "Əgər bunlar həruriləр və səbəilər deyillərsə, onların kim olduqlarını bilmirəm."[1308] əl-Hərb əl-Kirməni'nin suallarında keçir ki, "Əhməd bin Yunus bizə rəvayət etdi; dedi: İbn Əbi Zib bizə əz-Zuhri'dən belə dediyini rəvayət edir: "Xristianlara səbəiyyə (firqəsin)dən daha çox bənzəyən bir qövm görmədim." Əhməd (bin Yunus) dedi: "Onlar rafizilərdir."[1309] Əhməd bin Hənbəl deyir: "Muaz bizə rəvayət etdi; dedi: İbn Avn bizə rəvayət etdi; dedi: İbrahimə səbəiyyə (firqəsin)dən iki nəfər, əl-Muğira bin Said və Əbu Abdirrahim haqqında soruşdum. Hər ikisini tanıdı və dedi: "Onlardan uzaq durun, çünki hər ikisi də yalançıdır."[1310] Beləliklə də Abdullah bin Muhəmməd, Qatədə, əz-Zuhri və İbrahim ən-Nəxai kimi tabiin təqəbəsinin nümayəndələri yanında səbəilər bir firqə olaraq mövcud idilər.

Belə bir firqənin varlığı kifayət qədər tarixi dəlillər ilə sabit olub. Burada problem bu firqənin inandığı əsasların nə olduğunu müəyyən etməkdədir. Bunu müəyyən etmək çətindir, çünki əlimizdə o firqənin etiqadlarını elmi bir üslubda qeydə almış erkən bir qaynaq yoxdur. Lakin biz bu firqənin ortaya çıxdığı bir dönəmdə, hətta səhabələrin sağ olduğu bir dövrdə tarixən səbəiyyə firqəsinə nisbət edilmiş bəzi inancların müzakirə olunduğunu görürük. Misal üçün İmam əl-Buxari rəvayət edir ki, əl-Əsvad dedi: "Aişənin yanında zikr etdilər ki, Əli – radiyallahu anhu – (Peyğəmbərə) vasi idi. Dedi: "Nə vaxt vəsiyyət etdi ki? Mən axı onun başını sinəmə - və ya qucağıma – yaslamışdım! O bir ləyən gətirilməsini istədi, bunun ardınca qucağımda elə can verdi ki,

[1306] əl-Fəsəvi, "əl-Mərifə vat-Tərix", 2/742
[1307] əl-Buxari, "ət-Tərix əl-Kəbir", 6/236
[1308] "Təfsir ət-Təbəri", 5/207; ət-Turki çapı
[1309] "Məsəil Hərb əl-Kirməni", 3/1182; əl-Əcurri, "əş-Şəria", 5/2530
[1310] "əl-İləl va Mərifətur-Ricəl", səh: 183 (325)

onun öldüyünü hiss etmədim. O zaman nə vaxt vəsiyyət etdi?"[1311] Bu rəvayət bizə isbat edir ki, Aişə anamız hələ sağ ikən Əlinin Peyğəmbərin vasisi olduğunu deyən kəslər olub. Bunun dəqiq hansı tarixdə olduğunu bilmək imkanımız yoxdur. Eləcədə İmran bin Haris əs-Suləmi deyir ki, "İbn Abbas'ın yanına bir nəfər gəldi. (İbn Abbas) soruşdu: "Hardan gəlirsən?" Dedi: "İraqdan." Soruşdu: "Arxandan insanları hansı hal üzrə tərk etdin?" Dedi: "İnsanları Əlinin yenidən onlara qayıdacağını dedikləri halda tərk etdim..."[1312] Bu rəvayət ona dəlalət edir ki, hələ İbn Abbas sağ ikən Əlinin ölməməsi, hələ də diri olması, yenidən zühur etməsi inancı var idi və bu inanc İraqda, çox ehtimal ki, Kufə şəhərində mövcud idi. Lakin bunun marginal bir qrup olduğunu deməyimiz lazımdır, Kufədə daha sonra aşırı rafizi etiqadı da bu qrupun uzantısı olaraq yaşayıb.

Etiqad məzhəbi olaraq erkən şiələr üçün səciyyəvi olan xüsusiyyət Əlini səhabələr içində ən əfzəl hesab etmək olub. Bunu kiçik səhabələrdən Əbu Tufeyl Amir bin Vasilə əl-Leysi'yə – radiyallahu anhu – nisbət edirlər, onun Əlini digər səhabələrdən üstün hesab etdiyi deyilib. İbn Abdilbərr deyir ki, Əbu Tufeyl "Əbu Bəkr və Ömərin fəzilətini etiraf edərdi, lakin Əlini üstün tutardı."[1313] Sələfdə bu şəkildə Əlinin ən fəzilətli səhabə olduğuna etiqad etmiş kufəlilər olub. Yəhya bin Main deyir ki, "Yalə bin Ubeyd'i belə deyərkən eşitdim: "Atam Əlini Əbu Bəkr və Ömərdən üstün tuturdu, bu mənim də rəyimdir."[1314] Ubeyd bin Əbi Umeyyə əl-Hənəfi və oğulları əhlüs-sünnətin siqa ravilərindən və elm əhlindən sayılırlar. Bu mənada şiəlik Kufədə sünnət əhlindən olmuş bir çox alimdə olub. Hətta İmam Sufyan əs-Səvri əvvəl bu rəydə idi, lakin sonra Əlini sadəcə Osmandan üstün saymaq rəyini qəbul edir. Əhlüs-sünnətdə ricəl kitablarda hansısa ravidə şiəliyin olduğu deyildikdə əksər hallarda bu məna qəsd olunur, yəni Əlinin ən üstün fəzilətə sahib olması etiqadı nəzərdə tutulurdu. Səhabələri söyməyə isə "rafizilik" adı verilirdi. Bu mənadakı şiəlik şübhəsiz ki, günümüzdəki imamiyyə şiəliyi ilə eyni deyildir və biz kitabımızın bu hissəsində xüsusilə imamiyyə şiəliyinin bir məzhəb olaraq necə dəyişiklik keçdiyinə baxmaq istəyirik.

Onu da oxucunun diqqətinə çəkək ki, müəyyən bir məzhəbin tarixən dəyişikliklər yaşadığını göstərmək üçün onun bütün etiqadi

---

[1311] "Sahih əl-Buxari", 2590; "Sahih Muslim", 1636
[1312] "Sunən Said bin Mənsur", 2/594-595 (rəq: 207);
[1313] İbn Həcər, "əl-İsabə fi Təmyiz əs-Sahabə", 7/193;Darul-Kutubil-İlmiyyə, Beyrut, 1415
[1314] "Tərixu İbn Main", 1/159; İbn Mihraz rəvayəti

prinsiplərini analiz etməyə ehtiyac yoxdur. Kitabımız ümumən imamət inancını ələ aldığı üçün bu tarixi analizimizi də bu nöqtəyə xas qılmağa çalışmışıq. Lakin ehtiyac olduqda kənar məsələləri də misal verməyi uyğun görmüşük.

## İmami Şiəliyin formalaşması

Şiələr bu gün etiqad etdikləri məzhəbin Əli bin Əbi Talibin və onun şiələrinin etiqad etdikləri ilə eyni olduğuna inanmaq istəyirlər. Lakin tarixi faktlar, şiə alimlərinin etirafları bunun heç də belə olmadığını deyir. Hər şeydən əvvəl Əli bin Əbi Talib'dən - kərraməllahu vachəhu - sabit olmuş xəbərlər bu iddianı yalanlayır. Əslində həqiqət budur ki, müasir şiəlik tarixən bir çox mərhələdən keçib, tədricən formalaşıb. Əli bin Əbi Talib'in zamanındakı ilk şiələr günümüzdəki imamilik etiqadına inanmırdılar, onları ümumi müsəlmanlardan ayıran məsələ sadəcə olaraq siyasi tərcih idi; Əlinin düşərgəsində olanların bir qismi onun səhabələr içərisində ən fəzilətli olduğuna inanırdı, bununla belə Əbu Bəkri və Öməri sevirdilər, onların fəzilətini etiraf edirdilər. Əksər şiələr isə onların hər ikisini ən əfzəl səhabələr hesab edirdilər. Bu barədə qarşıda şiə alimlərinin öz etirafları ilə tanış olacağıq.

Şiə qaynaqlarını təsdiqləməli olsaq belə bir nəticəyə gələ bilərik ki, beşinci imam Əbu Cəfər Muhəmməd əl-Baqirə qədər şiələrdə bariz bir mədrəsə olmayıb. Cəfər əs-Sadiqə nisbət etdikləri bir xəbərdə o, deyir: "Əbu Cəfər gəlmədən əvvəl şiələr həcc ayinlərini, halalı və haramı bilmirdilər. Sonra Əbu Cəfər gəldi və onlara elmin qapılarını açdı, onlara həccin ayinlərini, halalı və haramı öyrətdi, hətta daha əvvəl (şiələr öz biliklərində) insanlara möhtac olduqları halda Əbu Cəfərdən sonra insanlar onlara möhtac oldular…"[1315] Muhəmməd əl-Baqir və Cəfər əs-Sadiqin zamanından başlayaraq məsumluq, itaət olunması vacib olan imamət fikirləri təbliğ olunmağa başladı. Məsumluq təlimini təbliğ edənin, onu əsaslandırmağa çalışanın Hişəm bin əl-Həkəm kimi

---

[1315] əl-Kuleyni, "əl-Kəfi", 2/19-21; əl-Məclisi "Mirətul-Uqul" kitabında (7/108) rəvayətin hər iki sənədi ilə səhih olduğunu deyir.

ravilər olduğu deyilib.[1316] Muhəmməd Asif əl-Muhsini qeyd edir ki, "imamın məsumluğuna dair gördüyüm ən qədim arqument Hişəm bin əl-Həkəm'in öz tələbəsi Muhəmməd bin Əbi Umeyr'ə gətirdiyi arqumentdir."[1317] Mötəzili alimlərdən əl-Qadi Abdulcabbar da bu mənanı təsdiqləyir və buyurur ki, "Hişəm bin əl-Həkəm'in zamanına qədər" heç kim bu fikri ortaya atmayıb, "bu məzhəbi çıxardan odur, ondan da bunu əl-Həddəd, əl-Varraq və İbnur-Ravəndi götürüb…"[1318] Bunun doğru olduğunu fərz etsək deyə bilərik ki, Kufədə 179-cu ildə vəfat etmiş Hişəmin zamanında ismət inancı təzəcə cücərirdi və şiələr arasında yayğın deyildi. İbnud-Nədimə görə ümumən imamət məzhəbi haqqında ilk danışan Hişəm bin əl-Həkəm və tələbəsi Əli bin İsmail bin Meysəm ət-Təmmər olub. ət-Təmmər haqqında - "imamət məzhəbində danışmış ilk kəs" - deyir, Hişəm haqqında isə "imamət barədə geniş danışmış, məzhəbi nəzəri dəlillərlə təhzib etmiş şiə kəlam alimlərindəndir" deyir.[1319]

İmamların itaət olunması bütün ümmətə fərz olan kəslər olduğunu öyrədənlərin başında Muhəmməd bin Əli bin ən-Numən əl-Bəcəli durur; şiələrin qaynaqlarında "Sahib ət-Taq" və ya "Mumin ət-Taq" ləqəbləri ilə tanınan odur. Onun zeydilər ilə, xüsusilə də zeydilərin imamı Zeyd bin Əli ilə dialoqlarından başa düşülür ki, Zeyd bin Əli bu mənada imam məfhumunu inkar etdiyi halda əl-Bəcəli bunu təbliğ edirdi və imamları tanımayanların cəhənnəmlik olduğunu iddia edirdi. Digər tərəfdən isə İmam Cəfər əs-Sadiqin ən sadiq ravilərindən olduğu iddia olunan Abdullah bin Əbi Yafur daha yumşaq bir mövqe göstərirdi; ona görə imamlar peyğəmbərlik məqamına bərabər bir məqama sahib məsum şəxslər yox, saleh alimlər olublar və onları tanımaq bütün ümmətə vacib olmayıb. Hüseyn ət-Tabətabəi əl-Mudərrasi erkən imami şiələri arasında bu cərəyanın başında duranın məhz Əbu Muhəmməd Abdullah bin Əbi Yafur (vəfatı hicri 131) olması qənaətindədir. Şiələrin arasında aşırı fikirlər yayılmadan əvvəl əksər şiələrin bu düşüncədə olmasını göstərmək üçün əl-Mudərrasi bizim diqqətimizi İbn Əbi Yafur'un öz zamanında qazandığı etibara yönəldir; bunu onun cənazəsində iştirak etmiş şiələrin çoxluğu ilə əsaslandırır. Əlavə edir ki, İbnul-Miqad'a görə abbasi xəlifəsi əl-Mehdi'nin (158-

---

[1316] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə liş-Şiə", səh: 17-18; Darul-Hədi, 1423

[1317] əl-Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/450; əl-Muhsini özü Hişəmin gətirdiyi arqumenti zəif hesab edir.

[1318] əl-Həmədəni, "Təsbitu Dələil ən-Nubuvva", səh: 2/528; Darul-Arabiyyə, Beyrut,

[1319] İbnud-Nədim, "əl-Fihrist", 1/632; Muəssəsətul-Furqan

169) zamanında "yəfuriyyə" firqəsi peyda olmuşdu və "mötədil" fikirləri ilə seçilirdilər. Bu fikirlərdən biri imaməti inkar edənləri təkfir etməmək idi.[1320] Görünür ki, Əbul-Həsən əl-Əşari də bu firqədən xəbərdar idi. O, imamları tanımağın vacibliyi məsələsində rafizilərin dörd firqəyə ayrıldığını deyir və buyurur: "Onlardan üçüncü firqə yəfuriyyə firqəsidir və onlar iddia edirlər ki, imamları tanımamaq caiz ola bilər, belə kəslər nə mömin, nə də kafirdirlər."[1321] Caiz ola bilər deməklə bunun vacib olmadığını qəsd edir. Şiə alimi Sad bin Abdilləh əl-Əşari'nin "əl-Firaq val-Məqalət" kitabına qeydlər etmiş Muhəmməd Cavad Məşkur bu barədə deyir: "Güman edirəm ki, Əbul-Həsən əl-Əşari'nin "Məqalət əl-İsləmiyyin" kitabında zikr etdiyi Yəfuriyyə firqəsi Abdullah bin Əbi Yafura nisbət olunur."[1322] əl-Mudərrasi qeyd edir ki, aşırı qruplar İbn Əbi Yafur'un fikrində olanları qaralamaq üçün onları "şiələrin mürciələri" adlandırırdılar və məqsədləri onları sünnilər ilə ortaq olmaqda ittiham etmək idi, çünki "mürciə" termini o dövrdə şiələrin yanında əməviləri dəstəkləyən sünnilər üçün işlədilirdi.[1323] Maraqlıdır ki, Cəfər əs-Sadiq'in oğlu Abdullah da sünnilərə yaxın olmaqda, yəni mürciə olmaqda ittiham olunub. əl-Mufid deyir ki, Abdullah "etiqadda atasına müxalif olmaqda ittiham olunurdu və deyilənə görə həşəvilərlə oturub durur və mürciənin məzhəbinə meyl edirdi…"[1324] Əgər imamın öz övladı imamlar haqqında müasir şiələrin sahib olduqları təsəvvürlərə sahib deyildisə bu bizə həmin dövrdəki imamilik inancının hələ formalaşmamış olduğunu göstərir. Abdullah bin Əbi Yafur'un cənazəsində iştirak edən kütlənin də "şiələrin mürciələri" olmaqla ittiham olunması göstərir ki, bu düşüncə sahibləri kiçik bir qrup olmayıblar. əl-Kəşşi rəvayət edir ki, Cəfər əs-Sadiq tələbələrindən birindən soruşub: "Abdullah bin Əbi Yafur'un cənazəsində iştirak etdinmi?" Dedim: "Bəli və orada çox sayda insan var idi." Dedi: "Sən orada şiələrin mürciələrindən çox sayda insan görəcəksən."[1325] Abdullah bin Əbi Yafur'un cənazəsində iştirak edənlərin çoxunun onun "mötədil" fikirləri ilə razılaşanlar olduğunu düşünmək təbiidir.

---

[1320] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə", səh: 51-52;

[1321] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", 1/49;

[1322] əl-Əşari əl-Qumi, "əl-Məqalət val-Firaq", səh: 227; Mətbəə Heydəri, Tehran, 1341

[1323] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə", səh: 53;

[1324] əl-Mufid, "əl-İrşad fi Mərifəti Hucəcilləhi aləl-İbəd", 2/210-211; Muəssəsətu Al əl-Beyt, Beyrut, 1429

[1325] ət-Tusi, "İxtiyar Mərifətir-Ricəl", 2/516;

Burada imamət inancının yayğınlaşması və şiələr tərəfindən qəbullanması ilə bağlı daha bir maraqlı tezis var. İbnud-Dəmiğani'yə görə imamət inancı şiələrin arasında abbasi dövlətinin məkirli siyasəti nəticəsində yayılmışdı. Onun iddiasına görə bu, abbasi xəlifəsi Əbu Cəfər əl-Mənsur'un Həsənin övladlarının nüfuzunu zəiflətmək üçün apardığı siyasətin nəticəsi idi. Məlumdur ki, Həsənin övladları arasında ən-Nəfsuz-Zəkiyyə ləqəbli Muhəmməd bin Abdilləh bin əl-Həsən və qardaşı İbrahim bin Abdilləh üsyan etmişdilər və abbasilər o üsyanları amansızlıqla yatırmışdılar. əl-Mənsur keysani şiələrindəki imamət inancının daha passiv olduğunu, qeybə çəkilmiş bir imama inandıqlarını görüb o formadakı imamət inancına siyasi dəstək vermək qərarına gəlir və bununla da zeydilik qoluna xas olan militant və mübariz imamət inancını zəiflətməyi məqsəd güdür. Bunun üçün öz adamlarının şiə cildinə girməsini, cahil şiələr arasında bu məzhəbi təbliğ etməklərini əmr edir. İbnud-Dəmiğani yazır: "Cəfər əs-Sadiq bunu eşitdikdə şiələrinin bu iddiasını inkar etdi, onlar isə (ona tabe olmaqdan) boyun qaçırdılar və dedilər: "Cəfər öz nəfsi üçün təqiyyə etdiyi üçün bizim bu sözümüzü inkar edir" və beləliklə də bu etiqad üzərində davam etdilər."[1326] İbnud-Dəmiğani çox maraqlı bir şəxsiyyətdir; tarixdə haqqında məlumatlar çox deyildir, lakin daha əvvəllər on iki imam şiəliyinə etiqad etmiş, sonra o məzhəbi tərk etmiş biri olaraq bu sözləri deyir.[1327]

Bəli. Şiə camaatlarında imamlar haqqında təsəvvür vaxt keçdikcə dəyişir və yeni çalarlar qazanırdı. O zaman üçün fikir ayrılığı, qarşılıqlı ittihamlar sıradan bir hal idi. əl-Kəşşi'nin rəvayət etdiyi bir xəbərdə İmam Əbul-Həsən'in yanına daxil olub şikayət edirlər. Onun yanına daxil olanların arasında Ali Yaqtin, Yunus bin Abdirrahmən, Cəfər bin İsa və başqaları olub. Cəfər bin İsa sözünə başlayaraq şikayət edir və deyir ki, "onlar bizi zındıq sayırlar, bizi təkfir edirlər, bizdən bəraət edirlər." İmamın cavabı isə belə olur: "Əli bin əl-Hüseyn və Muhəmməd bin Əli'nin əshabı, Cəfər və Musa'nın da əshabı belə idilər; Zurara'nın əshabı başqalarını təkfir edirdilər, başqaları da onları təkfir

---

[1326] İbnud-Dəmiğani, "əl-Cəvhəra əl-Xalisa", səh: 114-115; Al-Kamel Verlag, Köln, 2008

[1327] İbnud-Dəmiğani "əl-Cəvhəra əl-Xalisa" kitabında (səh: 166) yazır: "Mən İraqda imamiyyə məzhəbi üzərində böyümüşəm." Daha sonra fərqli ölkələri gəzdiyini, bütün məzhəblərlə tanış olduğunu, onları yaxından öyrəndiyini yazır. Lakin bu məzhəblərin hamısından uzaqlaşdığını, onların hamısında problemli gördüyü məqamların olduğunu bildirir. İctihad edə bilməyən və təqlid etməyə məcbur olanlara ya sünnilərin sufilərinə təqlid etməyi, ya da zeydi şiələrindən zahid olanlara təqlid etməyi tövsiyə edir.

edirdilər."[1328] İmam Həsən əl-Askəri'nin zamanında gedən qızğın mübahisələr imami şiələrini bir neçə qrupa bölmüşdü. Misal üçün Nişapur şəhərindəki şiələr iki camaata ayrılmışdılar; bir qrup "mufavvidanın" məzhəbinə müvafiq olaraq imamların fövqəltəbii elmə yiyələndiklərinə inanırdılar, imamların bütün dilləri, insanların, quşların və heyvanların dillərini və dünyada nələrin baş verdiyini bildiklərinə etiqad edirdilər. Onlar ilahi vəhyin peyğəmbərin - aleyhissalətu vassələm - ölümü ilə dayanmadığına, əksinə imamlarla davam etdiyinə inanırdılar. Digər qrup isə Fədl bin Şazan'ın başçılıq etdiyi "daha mötədil" bir qrup idi; onlar bütün bu iddiaları rədd edirdilər və inanırdılar ki, imamlar sadəcə mükəmməl şəriət biliklərinə sahib idilər və Quranın doğru təfsirini bilirdilər. Fədl bin Şazan'ın ölümündən bir neçə ay əvvəl şiələrdən xums toplayan elçi Nişapurda ikən gecələmək üçün özünə yer seçərkən birinci qrup ilə qalmağa üstünlük verdi və bu, ciddi bir konfliktə səbəb oldu. "Daha mötədil" olanlar bu elçinin etibarını sorğuladılar və xums ödəməkdən imtina etdilər. İddiaya görə məsələ imama ərz olundu və o, məktub yazaraq mufəvvidanın inanclarını qınadı, eyni zamanda Fədl bin Şazan'dan da xumsu ödəmədikləri üçün şikayət etdi.[1329]

Tədricən imamlar haqqında xüsusi bir inanca keçid edən ilk imami şiələr müasir terminologiya ilə desək "əxbarilər" olublar; daha dəqiq desək kəlam və fəlsəfədən uzaq olan rəvayət əhli olublar. Onları "əxbarilər" adlandırsaq da onlarla səfəvilərin zamanında ortaya çıxmış və şiələrdə "müctəhidlər" və ya "üsulilər" olaraq bilinən alimlərə müxaliflik etmiş "əxbarilər" eyni deyillər, amma aralarında ciddi bənzərliklər var. Erkən dönəmdəki şiə ravilərini, alimlərini "əxbarilər" adlandırmağımızın səbəbi isə onların ictihaddan uzaq olmaqları ilə bağlıdır. Çünki imamlar yaşadıqları müddətdə ictihada yer olmamalı idi, yalnız onların xəbərləri, fətvaları ilə əməl olunmalı idi. On birinci imam əl-Həsən əl-Askəri hicri 260-cı ildə vəfat edib, yəni sünnilərin ictihad məktəblərindən sonuncu sayılan hənbəli məktəbinin imamı Əhməd bin Hənbəl'dən təxminən 20 il sonra vəfat edib. Bu səbəblə bu ərəfədə hansısa ictihadi bir məktəbin formalaşması üçün şərait olmamalı idi. Şiə alimi Muhəmməd ən-Nəraqi qeyd edir ki, "onlardan – xüsusilə də

---

[1328] "İxtiyər Mərifətir-Ricəl", 3/90; Mühəqqiq xəbərin isnadındakı ravilərin siqa olduğunu yazır.

[1329] əl-Kəşşi, "Ricəl əl-Kəşşi", səh: 382-384; Muəssəsətul-Alə lil-Mətbuat, Beyrut, 1430; Daha geniş məlumat üçün bax: Modarressi, "Crisis and Consolidation in the Formative Period of Shi'ite Islam", səh: 38-39; The Darwin press, New Jersey, 1993

imamların əshabından – heç birindən ictihad etdikləri nəql olunmayıb."[1330] Şiə alimi əl-Burucurdi yazır ki, ilk şiə müəlliflər "fiqhi kitablarında imamlardan rəvayət edilmiş əsli məsələlərdən başqasını yazmırdılar… əksinə bir məsələni kitablarında hansısa rəvayətlərin mətnindən çıxarılmış bir ləfz ilə ifadə etdiklərini görürsən, o dərəcədə ki, o kitablara baxan kəs onların ictihad və istinbat əhlindən olmadıqlarını düşünə bilər."[1331] Əxbarilik və üsulilik haqqında qarşıda bir qədər geniş məlumat veriləcək.

## Kufə və Qum

Qeybət dönəmi başladıqdan sonra, yəni mamların vəfatından sonra şiələrdə formalaşmış mərkəzlərin içərisindən xüsusilə ikisi seçilir: Kufə və Qum. Kufə məktəbi şiəliyin bir cərəyan olaraq, bir etiqad məktəbi olaraq formalaşdığı ilk mərkəzdir. Qum şəhəri isə Kufədən yəmənli əşari qəbiləsinin bir hissəsinin oraya köçməsi ilə tədricən belə bir mərkəzə çevrilmişdir. Qum şəhəri Fars ərazisində şiəliyin ilk mərkəzi hesab edilir. Bu şəhərdə şiəliyin tarixçəsi hicri birinci əsrin son rübünə təsadüf edir. Həmin dövrdə Fars torpaqları İslamı qəbul etmək və ya rədd etmək məsələsində ciddi fikri münaqişələr yaşayırdı. Şiəlik isə Yəmən əsilli ərəb qəbilələrindən olan bir qrup vasitəsilə bu bölgəyə daxil olmuşdu. Onlar Kəhlan ibn Səbənin nəslindən idilər və babaları Nəbt bin Zeyd, dünyaya gəldikdə bədəni tüklü olduğundan "əl-Əş'ar" (tüklü) adını qazanmışdı[1332] və onun nəsli ona nisbət olaraq "əl-Əşari" nisbəti ilə tanınır. Bu nəslin ulu babası Malik ibn Amir bin Həni bin Xufəf əl-Əşari Peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – yanına gəlmiş nümayəndəlikdə olub və ona beyət edib. Qövmünün şairlərindən idi. İslama gəldikdən sonra xəlifə Ömərin zamanında - əmisi oğlu Əbu Musa əl-Əşəri'nin əmirliyi altında - İslam fəthlərində iştirak etmişdir. Onun bu fəthlərdə əl-Mədəin günündə Dəclə çayını ilk keçən şəxs olduğu yazılır.[1333] Qum şəhəri ilə

---

[1330] ən-Nəraqi, "Ənisul-Muctəhidin", 2/950;

[1331] əl-Burucurdi, "əl-Bədr əz-Zahir", səh: 19; Məktəbətul-Muntaziri, Qum, 1416

[1332] əl-Kəlbi, "Nəsəbu Məaddə val-Yəmən əl-Kəbir", 1/133;

[1333] İbnul-Əsir, "Usudul-Ğabə", 5/29 (4601)

"əşari" qəbiləsinin erkən zamandan tanışlığının olduğu yazılır. Beləki əl-Bələzuri qeyd edir ki, "Nəhavənddən geri döndükdən sonra Əbu Musa Abdullah bin Qeys əl-Əşari (orduları ilə) əl-Əhvaz'a doğru yönəlir və oranı tam şəkildə yoxlayıb dəyərləndirir. Sonra Quma gəldi və orada bir neçə gün dayanıb qaldı, sonra da oranı fəth etdi."[1334] Bu zaman əslində Qum şəhəri mövcud deyildi, lakin ərazidə yeddi kənd var idi. Malik bin Amir əl-Əşari və onun ailəsi sonralar Kufə şəhərinə köçmüş və Əli bin Əbi Talib'in müharibələrində onun tərəfində yer tutmuşlar. İbnul-Əsir yazır ki, Malik bin Amir Siffin döyüşündə Əlinin ordusunda vuruşub.[1335] Malikin oğlu Sad bin Malik İraqda şərəf və statusa sahib biri idi. Qardaşı əs-Səib bin Malik ibn Amir də şərəf sahiblərindən idi, zamanında Muxtar ibn Əbu Ubeydə əs-Səqəfi'nin (ö. 67 h./687 m.) İmam Hüseyn ibn Əli'nin (aleyhissələm) qatillərinə qarşı qaldırdığı üsyanda iştirak etmiş və onunla birlikdə öldürülmüşdür. O, Muxtarın mühafizə dəstəsində idi.[1336] Daha sonra əmisi Saib ibn Malik ibn Amirin ölümündən sonra Əhvəs və Abdullah adlı iki qardaş – Sa'd ibn Malik ibn Amirin oğulları – qəbilələrinə rəhbərlik etmişlər.

Qum şəhəri ilə bağlı əs-Səm'ani yazır: "Qum, İsfahan və Savə arasında yerləşən böyük bir şəhərdir və sakinlərinin əksəriyyəti şiədir. Bu şəhər hicrətin 83-cü ilində əl-Həccac ibn Yusufun dövründə salınmışdır. Həmin ildə Abdurrahmən bin Muhamməd bin əl-Əşas bin Qeys bin Mədi Kərib əl-Kindi (ö. 85 h./704 m.), əl-Həccac tərəfindən Sicistan valisi təyin edilmiş, lakin sonradan əl-Həccaca qarşı üsyan etmişdir. Onun ordusunda İraqdan olan tabein alimlərindən on yeddi nəfər var idi. Abdurrahmən ilə əl-Həccac arasında bir neçə döyüş baş verdi. Nəticədə Abdurrahmən məğlub olaraq Kabula geri döndü və ordusunun böyük hissəsi öldürüldü, sağ qalanlardan bir qismi isə qaçdı. Qaçanlar arasında əl-Əşar oğullarından Abdullah, əl-Əhvas, İshaq, Nueym və Abdurrahmən adlı qardaşlar – Sə'd ibn Malik ibn Amirin oğulları – Qum şəhərinin tikildiyi bölgəyə gəldilər. Onların rəhbəri Abdullah idi və o, Abdullah Sə'dan adı ilə tanınırdı. Həmin bölgədə bir-birinə yaxın yerləşən yeddi kənd vardı və hər kəndin də bir qalası və adı mövcud idi. Bu kəndlərdən birinin adı "Kumidan" idi. Qardaşlar çayın sahilində bir yerə çadır quraraq burada yerləşdilər. Onların qohumları bu xəbəri eşidəndə onlara qoşuldular. Birlikdə kəndlərin liderlərini öldürərək həmin kəndlərə nəzarəti ələ keçirdilər və

---

[1334] əl-Bələzuri, "Futuh əl-Buldən", səh: 304
[1335] İbnul-Əsir, "Usudul-Ğabə", 5/30
[1336] əl-Kəlbi, "Cəmhəratun-Nəsəb", 2/173;

sərvətlərini əldə etdilər. Yerli əhalini öz tərəflərinə çəkərək yeni tikililər inşa etdilər. Çadırlardan və digər əşyalardan istifadə edərək yeddi kəndi şəhərin yeddi məhəlləsinə çevirdilər və qəsrlər bu məhəllələrin adları ilə tanındı. Şəhərin adı, kəndlərdən biri olan "Kumidan" adından götürüldü. Qısaltmaq məqsədi ilə adından bəzi hərfləri çıxardılar və ərəb dilindəki istifadəyə uyğun olaraq "k" hərfini "q" hərfi ilə əvəz edərək şəhərə "Qum" adı verdilər. Abdullah Sə'dan'ın Kufədə Musa adlı bir oğlu var idi və o, Quma köçərək şiə məzhəbini burada yaydı. Bu hekayəni Əbul-Vafə Muhamməd bin Muhamməd bin əl-Qasim əl-Əxsikəsi[1337] tərəfindən öz tarix kitabında qeyd edir."[1338] Yaqut əl-Həməvi qeyd edir ki, Qum şəhərinə ilk məskən salmış əl-Əşari nümayəndəsi Talha bin əl-Əhvas əl-Əşari olub.[1339] əs-Səm'ani'nin sözündən belə anlamaq olar ki, əl-Əşari'lər arasında şiəliyi təbliğ edən ilk şəxs Musa bin Abdilləh bin Sad bin Malik əl-Əşari olub. əl-Həməvi hər hansı bir ad qeyd etmədən zikr edir ki, Abdullah bin Sad'ın "Kufədə böyüdülmüş bir oğlu var idi, oradan Qum şəhərinə köçdü və imami şiəsi idi, oranın əhalisinə şiəliyi yayan da o olub."[1340] Maraqlıdır ki, Musa haqqında əhlüs-sünnət qaynaqlarında heç bir xəbərlə rastlaşmaq olmur. Əbul-Qasim əl-Xoyi şiə ravilər haqqında yazdığı kitabda Musa bin Abdilləh bin Sad əl-Əşari əl-Qummi'nin adını qeyd edir və onun İmam Cəfər əs-Sadiq'in əshabından olduğunu yazır.[1341] Əhlüs-sünnət qaynaqlarında onun qardaşı Yaqub bin Abdilləh bin Sad bin Malik əl-Qummi əl-Əşari'nin və əmisi oğlu Əş'as bin Ishaq bin Sad bin Malik əl-Qummi'nin adını mötəbər ravilər arasında qeyd edirlər. Yaqub öz qardaşı İmran'dan, o da İmam Cəfər əs-Sadiq'dən rəvayət edir.[1342]

Musa bin Abdilləh əl-Əşari Kufədə bir şiə olaraq böyümüşdü və sonradan ailəsi ilə birlikdə Qum şəhərinə köçənlərdən biri idi. Ərəb ailələri ilə yanaşı onlarla "mövla" bağı olan əcəm qəbilələri də köç etmişdilər. Bunların arasında ən çox tanınanları əl-Bərqi ailəsi idi. Musanın qardaşı oğlu Muhəmməd bin İsa əl-Əşari şəhərdə şiələrin ilk şeyxlərindən biri olaraq məşhurlaşmışdı. O, şəhərdə böyük torpaq sahibi idi və hakimiyyət dairələri yanında xüsusi hörmətə sahib idi.

---

1337 Özbəkistanın zamanında şəhərlərindən olmuş Axsikənd şəhərindən çıxmış tarixçi və dil alimidir, hicri 520-ci ildən sonra vəfat edib. Qardaşı Əbu Raşəd Əhməd bin Muhəmməd isə tanınmış şair olub.
1338 əs-Səm'ani, "əl-Ənsəb", 4/542-543; əl-Cinən val-Fikr çapı.
1339 əl-Həməvi, "Mucəmul-Buldən", 4/397;
1340 Eyni mənbə, 4/397-398;
1341 əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 20/54
1342 Bax: Əbu Nueym əl-Əsbəhəni, "Tarix Əsbəhən", 1/466;

Onun oğlu Əbu Cəfər Əhməd bin Muhəmməd bin İsa əl-Əşari dini lider olaraq atasından da məşhur olacaqdı. O öz zamanında Qumdakı şiə camaatının şeyxi və fəqihi sayılırdı.[1343] Kufəyə və Bağdada səfər edərək oradakı şiə xəbərlərini Qumdakı tələbələrinə rəvayət etməklə tanınıb. 1988-ci ildə Qum şəhərində çap olunmuş "ən-Nəvadir" kitabı ona nisbət olunur. Qum şəhərində çox sayda tələbə hazırlayaraq ictimai bir qüvvəyə çevrilmişdi. Etiqadda aşırılığa qarşı mübarizəsində sərt tədbirlərə əl atmaqdan çəkinməzdi, aşırılıqda ittiham etdiyi bir çox şiə ravini Qum şəhərindən qovmağa nail olmuşdu. Özündən sonra tərk etdiyi alimlər arasında Sad bin Abdilləh, Muhəmməd bin əl-Həsən əs-Saffar, Muhəmməd bin Yəhya əl-Attar, Muhəmməd bin Əli bin Məhbub və Abdullah bin Cəfər əl-Himyəri kimi tanınmış şiə ravilərinin adları çəkilir. Onların içində Sad bin Abdilləh əl-Əşari öz müəlliminin işini davam etməkdə aktiv idi. Müəllimindən sonra şəhərdə şiələrin lideri və şeyxi də məhz o oldu. Şiə firqələri haqqında günümüzə qədər gəlib çatmış "Məqalət va Firaq əş-Şiə" kitabı da ona nisbət olunur. Onun kufə mədrəsəsinə xas olan bəzi etiqadlara qarşı mübarizə qoyduğunu, bu etiqadlara qarşı təbliğat apardığını onun Hişəm bin əl-Həkəm və Yunus bin Abdirrahmən kimi tanınmış şiə ravilərinə qarşı kitablarından anlayırıq. Hişəm bin əl-Həkəm kufə mədrəsəsinin təmsilçilərindən idi, Yunus bin Abdirrahmən isə onun ən məşhur tələbələrindən olub. Sad bin Abdilləh əl-Əşari təbliğatında və çalışmalarında öz müəlliminin xəttini davam etdirərək Hişəm bin əl-Həkəm və Yunus bin Abdirrahmən kimi kufəlilərin təsirinin qarşısını almağa çalışdığı halda Qum əhlindən bəzi şiə alimləri isə əksinə Yunus bin Abdirrahmən və müəlliminin təlimlərini Qum şəhərinə daşımaqda israrlı idilər. Bu ikinci cəbhənin bəlkə də ən məşhur nümayəndəsi İbrahim bin Haşim əl-Qummi olub. İbrahim bin Haşim və oğlu Əli bin İbrahim şiə hədis kitablarında ən çox hədis rəvayət etmiş iki ravidir. Məşhur "əl-Qummi təfsiri" də oğlu Əliyə nisbət olunur. Bir xəbər rəvayətçisi kimi ata və oğul şiələrin mirasında əvəz edilməz məqama sahibdirlər; beləki buna misal olaraq əl-Kuleyni'nin "əl-Kafi" kitabında Əli bin İbrahim'dən 7068 xəbər rəvayət etdiyini göstərmək olar və bunlardan 6214-ünü Əli öz atası İbrahim bin Haşim'dən rəvayət edir.

İmamlar haqqında aşırı inanca sahib olanlar əsasən Kufədə qərar tapmışdılar və Qum məktəbinin mənsubları onları aşırılıqda, ğuluvda ittiham edirdilər. Kufə məktəbi isə Qum məktəbini qüsurda ittiham edirdi. Qum məktəbinin ən məşhur təmsilçisi saya biləcəyimiz Şeyx əs-

---

[1343] Əhməd bin Muhəmməd əl-Əşari, "ən-Nəvadir", səh: 3-5;

Saduq yazır: "Mufəvvida və aşırıların əlaməti Qumun şeyxlərini və alimlərini təqsir rəyinə nisbət etməkdir."[1344] Təqsir deyildikdə imamları fövqəlbəşər xüsusiyyətlər ilə vəsf etməkdə qüsurlu davranmaq qəsd olunurdu. Misal üçün Şeyx əs-Saduq rəvayət edir ki, Əbus-Salt əl-Həravi deyib: "(İmam) Rzaya - aleyhissələm - dedim: "Ey peyğəmbər övladı, Kufənin camaatı arasında bir qövm var ki, peyğəmbərin namazda səhv etmədiyini iddia edirlər." Bunun üzərinə (Rza) dedi: "Yalan danışırlar, Allah onlara lənət etsin! Səhv etməyən Özündən başqa ibadətə layiq məbud olmayan Allahdır."[1345] Bu dönəmdəki Qum məktəbi yetişdirdiyi hədis alimləri ilə seçilir, Hişəm bin Həkəm kimi kufəlilər kəlam və spekulativ teologiya ilə məşğul olmaqla tanındıqları halda Qumdakı alimlər daha çox hədislə tanınıblar. Şeyx əs-Saduq kimi Qum məktəbinin ən son nümayəndələrində də artıq hədislə yanaşı kəlam elminin də kitablarına sirayət etdiyini görürük. Lakin qumluları digərlərindən ayıran ən böyük əlamət bəlkə də onların - yuxarıda dediyimiz kimi - imamlar barəsində aşırı təsəvvürlərə qarşı mübarizə aparmaqları olub. Bu o demək deyildir ki, qum məktəbinin nümayəndələrində aşırılıq olmayıb; sünnət əhlinin perspektivindən baxıldığında Qum məktəbi də imamlar barəsində aşırı inanclara sahib olublar, amma öz aralarındakı ölçü ilə hesablandıqda dərəcə baxımından qumlular kufəlilərə nisbətdə daha mötədil hesab olunurdular. əl-Mudərrasi yazır ki, "dördüncü əsrdə şiələrin ən bilikli mərciləri olan Qum alimləri müfəvvidlərə qarşı tam gücləri ilə mübarizə aparmağa, imamlara bəşəri səviyyədən yuxarı hansısa bir vəsfin verilməsini rədd etməyə davam edirdilər. Onlar etiqad edirdilər ki, pak peyğəmbər və imamların ilahi risaləti təbliğ etməklə əlaqəsi olmayan gündəlik həyati məsələlərdə belə xəta və səhv etməkdən məsum olduqlarına etiqad edən hər bir kəs aşırıdır. İmamlara bu cür fövqəlbəşəri sifətlər nisbət edən rəvayətləri mötəməd hesab etmirdilər, bu rəvayətləri və bu rəyləri nəql etməyi icazəli görmürdülər. Hətta Qum alimlərindən bir qrup inanırdı ki, imamlar itaət olunmaqları fərz olan kəslər, peyğəmbərdən sonra xəlifəliyə və cəmiyyətin rəhbərliyinə təyin olunmuş kəslər olmaqlarına baxmayaraq şəriət elmlərini bilmək metodunda digər din alimlərindən fərqlənmirdilər; yəni cüzi fəri hökmləri öyrənmək yolunda (digər alimlər kimi) ictihad edirdilər, üsuldan furu məsələlərini çıxarırdılar."[1346] Bir digər şiə alimi əl-Hairi əl-

---

[1344] əs-Saduq, "əl-İtiqadət", səh: 101;

[1345] əs-Saduq, "Uyun Əxbər ər-Rida", 1/219;

[1346] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə", səh: 68-69;

Məzəndərani yazır ki, "alimlərimizin əksəriyyəti və ən etibarlıları (Qum alimlərinin) nəzərində aşırı sayılırlar, hətta onları Qum şəhərində görsəydilər oradan qovardılar."[1347] Bu bizə onu göstərir ki, bu dönəmdəki şiələrdə vahid bir məzhəb mövcud deyildi, əksinə şiələrin yaşadıqları bölgələr fərqləndikdə etiqadlar arasında da fərqlər olurdu.

## Mötəzili təsirləri

Hakimiyyət dairələrinin bu dönəmdə apardıqları siyasət və mötəzili alimlərə yaxınlıq nəticəsində şiələrdə mötəzililər kimi rasional üsulilik formalaşmağa başladı. Bu keçid dövründən əvvəl şiələrin əksəriyyəti tövhid məsələlərində tamamilə başqa fikirlər ilə tanınırdılar. Bir çox tarixçilərə görə bu erkən dönəmdə şiələrin əksəriyyətində, o dövrün əxbariləri adlandırdığımız "xəbər əhli" olan şiələrdə yayğın olan etiqad təşbih və təcsim etiqadı olub. Bunun ən məşhur misalı imami şiələrin böyüklərindən sayılan Hişəm bin əl-Həkəm'in misalıdır. Abdulqahir əl-Bağdadi onun haqqında yazır: "Əbul-Huzeyl kitablarından birində yazır ki, Məkkədə ikən Əbu Qubeys dağının yanında Hişəm bin əl-Həkəm ilə qarşılaşdı və ondan "hansının daha böyük olduğunu soruşdu: məbudunun yoxsa dağın?" Dedi: "Dağın Allahu təaləni örtdüyünə, Ondan böyük olduğuna işarə etdi." İbn ər-Ravəndi kitablarının birində Hişamın belə dediyini nəql edir: "Allah ilə fiziki cisimlər arasında bəzi baxımdan bənzərlik mövcuddur; əgər belə olmasaydı cisimlər Allaha dəlalət etməzdi.".. Əbu İsa əl-Varraq kitabında deyir ki, Hişamın tələbələrindən biri ona cavab verib ki, Allah Ərşə toxunur və ondan ayrılmır, Ərş də Allahdan ayrılmır."[1348] əl-Bağdadi bu təşbih etiqadını həmçinin Hişəm bin Səlim əl-Cəvaliqi'yə, həm də Yunus bin Abdirrahmən əl-Qummi'yə aid edir. Şiələr təbii ki, Hişəmi təcsim etiqadından tənzih edirlər və onun bu etiqadda olduğunu qəbul etmirlər. əl-Murtəda əş-Şərif yazır ki, ondan Allahın həqiqi mənada cisim olması ilə bağlı gəlmiş xəbərləri "biz yalnız əl-Cahiz'in ən-Nəzzam'dan rəvayəti ilə bilirik."[1349] Beləliklə də o, bunu

[1347] əl-Məzəndərani, "Muntəqa əl-Məqal fi Əhval ər-Ricəl", 3/51;

[1348] əl-Bağdadi, "əl-Fərq beynəl-Firaq", səh: 65-66; Məktəbətu İbn Sina, Qahirə

[1349] əl-Murtəda, "əş-Şəfi fil-İməmə", 1/84;

mötəzililərin yalanları olaraq təqdim edir. Lakin bu ittihamlar təkcə mötəzili qaynaqlarında gəlməyib, həmçinin qədim şiə qaynaqlarında da gəlib, hətta onun bu etiqadda olduğunu təsdiq edən şiə alimlər də olub. Misal üçün əl-Həsən bin Musa ən-Növbəxti "əl-Əra vad-Diyənət" kitabında Hişəmin xalis təcsim etiqadında olduğunu nəql edir.[1350] Həmçinin əl-Bərqi onun "cismi" olduğunu, yəni təcsim etiqadında olduğunu yazır.[1351] Ən əsası isə şiələrin öz hədis kitablarında Hişəm bin əl-Həkəm'in və başqalarının təcsim etiqadında olmasına dair xəbərlər varid olub. İbn Bəbəveyh əl-Qummi "ət-Tövhid" kitabında "Allah - azzə va cəllə - nə cisim, nə də surətdir" adlı bir bölmə açır və orada Hişəm bin əl-Həkəm və Hişəm bin Səlim ilə bağlı rəvayətlərə yer verir. Birinci rəvayətdə Muhəmməd bin Hukeym deyir: "Əbul-Həsən'ə Hişəm əl-Cəvaliqi'nin sözünü və onun (Allahın) gözəl gənc (olması ilə bağ)lı nə dediyini vəsf etdim və Hişəm bin əl-Həkəmin sözünü də vəsf etdim və dedi: "Allaha - azzə va cəllə - heç bir şey bənzəməz."[1352] İkinci xəbərdə Muhəmməd bin əl-Fərac ər-Ruxxaci deyir: "Əbul-Həsən'ə yazaraq ondan Hişəm bin əl-Həkəm'in cisim barəsində və Hişəm bin Səlim'in surət barəsində dediklərini soruşdum. Cavabında yazdı: "Bu heyrəti burax, şeytandan Allaha sığın və hər iki Hişamın dedikləri doğru deyildir."[1353] Dördüncü rəvayətdə isə Əli bin Əbi Həmzə deyir: "Əbu Abdilləhə dedim: "Hişəm bin əl-Həkəm sizdən rəvayət edir ki, Allah cisimdir, samədidir, nurdandır…" Dedi: "Heç kimin necə olduğunu bilmədiyi Allah nöqsanlardan pakdır…. nə cisimdir, nə də surətdir."[1354] əs-Saduq kitabında bundan əlavə Hişam ilə bağlı daha üç rəvayət zikr edir. ən-Nəcəşi ricəl kitabında Əbu Cəfər Muhəmməd bin Xalil əs-Səkkək əl-Bağdadi haqqında yazarkən deyir: "Hişəm bin əl-Həkəm'in yoldaşı və tələbəsi idi, ondan elm öyrənib. Ona aid bir neçə kitab mövcuddur; İmamət mövzusunda bir kitabı var və həmçinin "tövhid" adlandırdığı bir kitabı var, (həqiqətdə) bu kitab (tövhid yox), təşbihdir…"[1355] Bu da ona dəlalət edir ki, Hişəmin inancında təşbih ittihamına səbəb olacaq ünsürlər olub. ən-Nəcəşi şiələrin ən tanınmış ricəl və fihrist alimlərindəndir və onun bu şahidliyi çox önəmlidir. Onun

---

1350 İbn Əbil-Hədid, "Şərh Nəhcul-Bələğə", 3/228;

1351 əl-Bərqi, "Ricəl əl-Bərqi - ət-Tabəqat", 1/35; Tehran universiteti yayını

1352 əl-Kuleyni bunu "əl-Kafi" kitabında (1/106) rəvayət edir. "Miratul-Uqul"da (2/8) əl-Məclisi isnadının məchul olduğunu deyir.

1353 Həmçinin bax: əl-Kuleyni, "əl-Kafi", 1/105;

1354 əl-Kuleyni, "əl-Kafi", 1/104; əl-Məclisi kitabında (2/2) isnadının muvassəq olduğunu yazır.

1355 "Ricəl ən-Nəcəşi", səh: 328-329;

sözündən anlaşılır ki, əs-Səkkək'in "tövhid" barəsində yazdığı kitab əslində təşbih etiqadını təmsil edirdi.

Amma insaf xatirinə etiraf etməyimiz lazımdır ki, Hişamdan təcsim etiqadı ilə bağlı nəql olunanlar bir mənalı deyildir, çünki bəzi nəqllər onun bunu Əbu Şəkir əd-Deysani'nin məzhəbində ikən dediyini xəbər verir. Bəzi nəqllər isə onun "cisim" ilə bizim anladığımız mənada bir cisim olmağı yox, lakin "cisim" sözünü "mövcud olan" mənasında işlətdiyini göstərir. İmam Əbul-Həsən əl-Əşari (h. 260-324) deyir: "Hişəm bin əl-Həkəm dedi: "Cismin mənası "mövcud" deməkdir." O belə deyərdi: "Mən cisim ilə yalnız "mövcud olanı", "şeyi", "özlüyündə qaim olanı" qəsd edirəm."[1356] Bütün bunları nəzərə aldıqda aydın olur ki, Hişəmin təcsim etiqadına nisbəti mübahisəlidir. İbn Əbil-Hədid bu mübahisələrin onun dövründə də getdiyini xatırladaraq buyurur: "Bizim bu zamanımızda Hişam bin Həkəm'in təəssübkeşliyini edən şiələr onun mə'nəvi təcsim etiqadında olmadığını, onun sadəcə olaraq "Allah 'cisimdir, lakin digər cisimlər kimi deyildir' dediyini iddia edirlər. Yəni Yunus və əs-Səkkək'dan nəql etdiyimiz mənanı qəsd edirlər. Halbuki, Həsən bin Musa ən-Növbəxti – ki, o, şiələrin fəzilət sahiblərindən sayılır – 'əl-Ara' vad-Diyənət' adlı kitabında Hişam bin Hakəmin saf bir şəkildə təcsimə inandığını rəvayət etmişdir."[1357] əs-Səkkək yuxarıda qeyd etdiyimiz kimi Hişəm'in tələbələrindəndir və şiələrin ən böyük ricəl alimi ən-Nəcəşi'nin onun təşbih etiqadında olması barədə şahidliyi ilə tanış olduq. Hişəm sadəcə olaraq burada bir misal idi və həqiqətən də təşbih və təcsim mövzularında kitablarda ən çox adı sadalanan şəxslər arasında onun adı da keçir. O, öz dövründə şiələrin etiqad mövzusunda müəllimlərindən sayıla bilər, çünki günümüzün şiəliyində imamətlə bağlı bir çox fikrin nəzəri olaraq əsasını onun qoyduğu deyilir. Hətta Hişəmin özünün təcsim və təşbih məsələsindəki mövqeyinin mübahisəyə açıq olduğunu qəbul etsək belə bu, ümumi mənzərənin, yəni ümumilikdə şiələr arasında bu etiqadın o dövrdə yayğın olmasını mübahisəli etmir. Əksinə erkən dönəmdə şiələrdə bu və buna yaxın etiqadlar yayğın idi. Zeydi alimi Əbu Said əl-Cuşəni bunu təsdiqləyərək yazır: "Onların sələflərinin əksəriyyəti - misal üçün Hişəm bin əl-Həkəm, Bəbəveyh ailəsi və onların əmsalı - cəbr və təşbih rəyində idilər."[1358] Ola bilsin ki, bu müəllifin zeydi məzhəbindən olduğunu deyib qərəzliliyinə eyham olunsun, lakin həm yuxarıda təqdim etdiyimiz

[1356] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", səh: 304; Ritter çapı

[1357] İbn Əbil-Hədid, "Şərh Nəhcil-Bələğa", 3/228;

[1358] əl-Cuşəni, "ər-Risələ fi Nəsihətil-Ammə", səh: 60;

məlumatlar, həm də bəzi görkəmli şiə alimlərin etirafları bu şahidliklərə etibar qazandırır. əş-Şərif əl-Murtəda misal üçün risalələrinin birində yazır: "Mötəzililər hamılıqla, şiələrin xeyli bir hissəsi, zeydilərin, xaricilərin və mürciələrin hamısı deyir ki, Allahın - təbərakə va təalə - hərəkət etməsi mümkün deyildir, yerlərdə və ya müəyyən bir yerdə olması mümkün deyildir və Allah elmi ilə hər yerdədir, hər yeri tədbir edir. Hişəm bin əl-Həkəm, Əli bin Mənsur, Əli bin İsmail bin Meysəm, Yunus bin Abdirrahmən Məvla Al Yəqtin, (Hişəm) bin Səlim əl-Cəvaliqi, həşəvilər və müşəbbihə camaatı isə dedi: "Allah müəyyən bir məkandadır, hərəkət və intiqal edir. Allah bu iftiradan uca və pakdır!"[1359] Burada əş-Şərif əl-Murtəda təşbih və təcsim etiqadını kufəli ravilərə nisbət edir, çünki adlarını çəkdiyi ravilər kufəlidirlər. əş-Şərif əl-Murtəda bir başqa yerdə Qum mədrəsəsinin mühəddislərini ittiham edərək deyir: "Qummilərin heç birinə istisna qoymadan - yalnız Əbu Cəfər bin Bəbəveyh müstəsna - hamısı dünən təşbih və cəbr etiqadında idilər və onların yazıları və kitabları buna şahidlik edir, bunu dilə gətirir."[1360] Şiə aliminin qəsd etdiyi rəvayətlər şiə kitablarından məlumdur. Misal üçün bəziləri tərəfindən dörd yüz üsuldan hesab olunan Zeyd ən-Nərsi'nin nüsxəsində Cəfər əs-Sadiq'in belə dediyi rəvayət olunur: "Qiyamət günü Allah mömin bəndəsini müxasara edər və mömin də Rəbbini müxasara edər, Ona günahlarını xatırladar." Mən dedim: "Müxasara nə deməkdir?" O əlini çanağımın üstünə qoydu və dedi: "Bizdən birimiz qardaşı ilə gizli bir məsələni pıçıldayaraq danışmaq istədikdə bu cür etdiyi kimi."[1361] Müxasara ərəb dilində bir kimsənin öz əlini çanağının üstünə qoymasıdır, müxasaranı başqasına etdikdə öz əlini onun çanağı, yəni böyrü üstün qoyur. Zeyd ən-Nərsi növbəti rəvayəti yenə Abdullah bin Sinan vasitəsi ilə Cəfər əs-Sadiq'dən belə rəvayət edir: "Allah Ərəfə günündə günortadan sonra yerə enər, ağ rəngli bir dəvənin üzərində olar və budları ilə Ərəfat əhlini sağa və sola toxunaraq onları istiqamətləndirər. Bu hal gün batana və insanlar oradan ayrılana qədər davam edər. Sonra Allah iki Mə'zim dağında[1362] iki mələk vəzifələndirər, onlar dar keçiddə durub nida edərlər: 'Ey Rəbbimiz, salamatlıq ver, salamatlıq ver!' Rəbb isə səmaya yüksələr və buyurar: 'Amin, amin, aləmlərin Rəbbi!' Buna görə də

---

[1359] əl-Murtəda, "Rasəil əş-Şərif əl-Murtəda", 3/281;

[1360] əl-Murtəda, "Rasəil əş-Şərif əl-Murtəda", 3/310; Dar əl-Quran əl-Kərim, 1405, Qum

[1361] "əl-Usul əs-Sittə Aşəra", səh: 203-204;

[1362] Ərəfat ilə Müzdəlifə arasında iki dağdır.

Ərəfatda az qala heç bir yıxılan və ya zərər görən olmaz."[1363] Zeyd ən-Nərsi və onun nüsxəsi şiə alimlərinin kitablarında məşhurdur, hətta əl-Məclisi qeyd edir ki, mühəddislər hər zaman onun kitabına etibar ediblər. Seyyid Mehdi Bəhrul-Ulum "əl-Fəvaid ər-Ricəliyyə" kitabında bu əslin etibarlılığına şahidlik edir.[1364]

Əlimizdə olan xəbərlər təsdiq edir ki, kufəli ravilər və qumlu şiəlilər mötəzililərin etiqadında olmayıblar. Əksinə sahib olduqları etiqad həm mötəzililərə, həm də imamilərin bağdad məktəbinə görə təşbih etiqadıdır. Misal üçün əl-Kəşşi'nin rəvayət etdiyi bir xəbərdə Muhəmməd bin İsa deyir: "Hişəm əl-Məşriqi mənə rəvayət etdi ki, Əbu əl-Həsən əl-Xorasani'nin - aleyhissələm - yanına daxil oldu və dedi: "Basra əhli "kəlam" haqqında soruşurlar və deyirlər ki, Yunus (bin Abdirrahmən) deyir: "Kəlam məxluq deyildir." Onlara dedim: "Yunus doğru deyir. Şübhəsiz ki, (Allahın) kəlam(ı) məxluq deyildir, məgər sizə Əbu Cəfərin - aleyhissələm - Quran haqqında "xaliqdir yoxsa məxluqdur" sualına verdiyi cavab çatmayıbmı? (Əbu Cəfər) onlara demişdi: "Nə xaliqdir, nə də məxluqdur. O, yalnızca Xaliqin kəlamıdır."[1365] Məlumdur ki, mötəzililər və onlara müvafiq olmuş bağdadlı imamiyyə məktəbi Quranın məxluq olduğunu deyirlər. Bu isə onu göstərir ki, əl-Mufid, əl-Murtəda, Şeyxut-Taifə ət-Tusi kimi şiə alimlərinin zamanında şiələrdə böyük ölçüdə üsuliləşmə prosesi tamamlanmadan əvvəl çox müxtəlif etiqadlar mövcud idi. Bu etiqadların içində "təşbih" inancının da yer aldığını gördük. Bu vəziyyət tədricən dəyişəcəkdi. Bu həqiqəti İmam Əbul-Həsən əl-Əşari də dilə gətirir. "Məqalət əl-İsləmiyyin" kitabında rafizi firqələri haqqında yazarkən deyir: "Rafizilərdən altıncı firqə deyir ki, onların Rəbbi nə cisim, nə də surətdir, heç bir şeyə bənzəməz, hərəkət etməz, sükunətdə də deyildir və toxunmaz. Onlar tövhid mövzusunda mötəzililər və xaricilər ilə eyni rəydədirlər. Bunlar onların arasından son dönəmlərdə ortaya çıxanlardır, amma onların ilkin üzvləri daha əvvəl nəql etdiyimiz

---

[1363] Eyni mənbə; səh: 204;

[1364] Bəhrul-Ulum, "əl-Fəvaid ər-Ricəliyyə", 2/360-367; əl-Məclisi "Bihərul-Ənvar"da (1/43) Zeyd ən-Nərsi və Zeyd əz-Zərrad'ın üsulu haqqında danışarkən deyir: "Biz bu iki nüsxəni şeyx Mənsur bin Həsən əl-Abi'nin öz xətti ilə düzəltdiyi qədim bir əlyazmadan əldə etdik. O isə bunu böyük şeyx Məhəmməd bin Həsən əl-Qummi'nin xəttindən köçürmüşdür. Bu nüsxənin yazılma tarixi üç yüz yetmiş dördüncü il (374 H) idi. O, həmçinin bu iki nüsxəni və bundan sonra qeyd olunan digər üsulu mübarək şeyx Harun bin Musa ət-Tələkbəri'nin xəttindən götürdüyünü bildirmişdir."

[1365] "İxtiyər Mərifətir-Ricəl", 3/76; Kitabın mühəqqiqi ravilərinin siqa olduğunu yazır.

kimi təşbih rəyində idilər."[1366] əl-Əşari şiələrdə mötəzili təsirləri altında keçid dövrünün baş verdiyi bir zamanda yaşayırdı. Ondan bir qədər əvvəl yaşamış, yəni hicri üçüncü əsrin sonlarında yaşamış və yazmış mötəzili alimi İbnul-Xayyət öz zamanındakı şiələri vəsf edərkən onların "Rəblərini məxluqlara bənzətdiklərini" yazırdı.[1367] İbnul-Xayyət'dən əvvəl yaşamış, hətta əl-Həsən əl-Askəri'dən əvvəl vəfat etmiş məşhur ədib Əbu Osman əl-Cahiz yazır: "Onlardan bir qismi isə deyirdi ki, Allah görülməz və bundan artıq heç bir şey demirdilər. Əgər təşbih ilə ittiham olunmaqdan qorxsaydılar, ən uzağı "O, necə olduğu bilinmədən görülər" deyərdilər. Bu sözləri isə təcsim və surət verməkdən çəkinərək söyləyirdilər. Lakin bir zaman gəldi ki, bu fitnə ortaya çıxdı və bu rafizilər danışmağa başladılar. Beləliklə, Allah üçün cisim təsdiq etdilər, Onun üçün bir surət və hədd müəyyən etdilər və Allahın necə olduğunu bilmədən görülə biləcəyini deyənləri təkfir etdilər."[1368] əl-Cahiz'in şahidliyi də çox erkən bir şahidlikdir. İmam əl-Həsən əl-Askəri hicri 232-ci ildə doğulub 260-cı ildə ömrünün gənc çağında vəfat etdikdə əl-Cahiz artıq beş ildir ki, qəbirdə yatırdı və hicri 255-ci ildə vəfat edərkən yaşı doxsanı keçmişdi. Hicri ikinci əsrin sonlarında və üçüncü əsrin əvvəllərində yaşamış şiə camaatlarını, onların fəaliyyətlərini, onların iddialarını yaxından tanıyan biri idi. Əgər onun zamanında "rafizi" adı ilə tanınan şiələr bu gün tanındıqları etiqad ilə tanınmış olsaydılar onlara bu rahatlıqla təşbih və təcsim etiqadını nisbət etmək mümkün olmazdı. Əbul-Hüseyn İbn əl-Xayyat (vəfatı təqribən h. 300) və Əbul-Həsən əl-Əşari (h. 260-324) erkən bir zamanda qədim şiələri mötəzililərdən təsirlənmiş sonrakı dönəm şiələrdən ayırırlar və onların sözləri ilə tanış olduq. Əbul-Fəth əş-Şəhristani (h. 467-548) yazır ki, şiələrin "bizim zamanımızda əksəriyyəti təqlid əhlidir; rəy və ictihada əsaslanmırlar. Üsula gəldikdə isə onlar mötəzilənin rəyinə daban dabana müvafiqdirlər…"[1369] Şiəliyin belə böyük bir keçid etməsi əs-Saduq, əl-Mufid, əl-Murtəda və ət-Tusi kimi şəxslərin əməyi ilə bağlıdır.

Şiələrdə "üsuli" və "kəlami" tendensiyaların güclənməsi buveyhilərin hakimiyyətdə olduğu dönəmə təsadüf edir. Bir çox tarixçi, şiələrdə mötəzili təsirlərinin güclənməsi və oturuşması dönəmini buveyhilər ilə əlaqələndirir. əz-Zəhəbi "Mizənul-İtidəl" kitabında yazır

---

[1366] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", səh: 35; Ritter çapı

[1367] əl-Xayyət, Kitəb əl-İntisar var-Raddu alə İbn ər-Ravəndi əl-Mulhid", səh: 4; əd-Dar əl-Arabiyyə lil-Kitəb, Beyrut, 1413

[1368] əl-Cahiz, "ər-Rasəil", 2/18;

[1369] əş-Şəhristani, "əl-Miləl van-Nihəl", 1/162;

ki, "üç yüz yetmişinci illərdən bizim zamanımıza qədər rafizilik və mötəzililik dostlaşıblar və qardaş olublar…"[1370] İbn Həcər onun bu sözlərinə düzəliş edərək yazır: "Onun dediyi kimi deyildir, onlar (xəlifə) əl-Məmun'un zamanından bəri qardaş olmağa davam edirlər…"[1371] Bu nöqtədə bəlkə də əz-Zəhəbi'nin dedikləri tarixən daha dəqiq görünür; çünki İbn Həcərin qəsd etdiyi əslində imami müəlliflərin arasında mötəzili etiqadında olanların daha erkən bir zamanda mövcud olduğunu göstərmək idi. Bəli, həqiqətən də imami şiələri arasında mötəzili etiqadında olan alimlər buveyhilərdən əvvəl də mövcud olublar. Bəzilərinə görə imami şiələri arasında mötəzili fikirlərini yayan, onları "özünküləşdirən" ilk şiə alimləri Növbəxti ailəsinə mənsub olublar.[1372] Xəlifə əl-Mutəmid hicri 260-cı illərdə Zənc qiyamçılarının paytaxtını ələ keçirdikdə şiə etiqadlı İsmayıl bin Bülbül'ü vəzir təyin etdi və İsmayıl şiə tacir ailəsi Bənul-Furatı önəmli vəzifələrə yerləşdirdi, həmçinin Növbəxt ailəsinə dəstək verdi. əl-Mutəmid'in zamanında Təbəristandan zeydilərin göndərdikləri malların İraqa və Hicaza bölünməsinə icazə verilir və Müaviyənin ictimai olaraq lənətlənməsi təşviq olunurdu, hətta Müaviyənin təriflənməsi, ona xeyir-dualar edilməsi qadağan edilirdi.[1373] Beləliklə də tədricən formalaşan bu yeni cərəyan özündən əvvəlki "əxbari" şiələrdən, xüsusilə də Qum şəhərindəki ənənəvi hədis alimlərindən bir çox baxımdan fərqlənirdi. Bu proses daha erkən zamandan başlasa da buveyhi dövlətinin himayəsi və dəstəyi altında sürətləndi. Buveyhi dövlətinin əsasını qoymuş Ruknud-Dövlə Əbu Əli əl-Həsən əd-Deyləmi (h. 284-366) şiələrin məşhur mühəddis alimlərindən olan İbn Bəbəveyh əl-Qummi'ni himayə etmiş və onun fəaliyyətinə rəvac vermişdi. Əli Əkbər əl-Ğifəri "Kəməlud-Din" kitabının müqəddiməsində Ruknud-Dövlə'nin onu aşırı təzim etdiyini, onun məzhəbini və verdiyi cavabları "gözəl qarşıladığını" yazır.[1374] Xorasanda İmam ər-Rida'nın qəbrini ziyarət etmək istədikdə

---

[1370] əz-Zəhəbi, "Mizənul-İtidəl", 3/149;

[1371] İbn Həcər, "Lisənul-Mizən", 5/570; Əbu Ğuddə

[1372] Qeyd etməliyik ki, növbəxtilər ailəsi şiələr arasında ilk rasional mötəzili alimlər hesab olunsalar da onlarla daha sonrakı üsulilər arasında önəmli fərqlər var idi. Bu fərqlərdən bir çoxunu əl-Mufid "Əvail əl-Məqalət" kitabında qeyd edir. Misal üçün əl-Mufid həmin kitabda (səh: 67) imamların bütün sənətləri və bütün dilləri bilməkləri haqqında danışarkən qeyd edir ki, növbəxtilər bu məsələdə mufəvvida və aşırı şiə qruplarına müvafiq olublar və bu cür bilikləri imamlar üçün əqlən və qiyasən vacib görüblər.

[1373] Andrew J. Newman, "Twelver Shiism: Unity and Diversity in the Life of Islam", səh: 42; Edinburgh University Press, 2013

[1374] "Kəməlud-Din va Təməmun-Nimə", 1/25;

Ruknud-Dövlədən icazə aldığını, onun isə bunun qarşılığında ondan türbədə onun üçün dua etməsini istədiyini yazır. Buveyhi əmirlərinin etiqad olaraq şiə olmaqları aşkardır. İbnul-Əsir hicri 351-ci ilin hadisələri haqqında yazarkən deyir: "Bu il rabiul-axir ayında Muiz əd-Dövlə'nin əmri ilə şiələr Bağdadda məscidlərdə bu yazını yazdılar: "Allah Müaviyə bin Əbi Sufyana lənət etsin və Fatimənin - radiyallahu anhu - Fədəki almasına mane olana lənət etsin, əl-Həsənin babasının - aleyhissələm - qəbri yanında dəfn olunmasına mane olana, Əbu Zərr əl-Ğifari'ni sürgün edənə və Abbası şuradan çıxardana lənət etsin!" Xəlifəyə gəldikdə o, onların hökmü altında idi, bunun qarşısını almaqdan aciz idi. Muiz əd-Dövləyə gəldikdə isə bunların hamısı onun əmri ilə edildi. Gecə olduqda insanların bir hissəsi bu yazıları qopardılar; Muiz əd-Dövlə yazıları bərpa etmək istədi, amma vəzir Əbu Muhəmməd əl-Muhəlləbi məsləhət gördü ki, silinmiş yazıların yerinə "Allah elçisinin - salləllahu aleyhi va səlləm - ailəsinə zülm edənlərə Allah lənət etsin!" yazılsın və Müaviyədən başqa heç kimin adı qeyd olunmasın!"[1375] Hicri 352-ci ildə muhərrəm ayında Bağdadın küçələrində əzadarlıq edənlərlə birlikdə çıxanlar arasında Muiz əd-Dövlə də var idi. Həmin ilin zulhiccə ayında isə rəsmi olaraq ğadir-xum bayramı qeyd olunmağa başladı. 363-cü ildə bir başqa buveyhi əmiri Adud əd-Dövlə'nin əmri ilə Təxt-i Cəmşiddə on iki imamın adları yazılmış lövhə quruldu. Adud əd-Dövlə həmçinin "Nəcəfdə bir qəbir ortaya çıxardı və onun İmam Əlinin qəbri olduğunu iddia etdi, üzərində məşhəd tikdi."[1376] Kərbalada isə Hüseynin qəbri üçün türbə tikdirmişdir.[1377] Şiələrin ən böyük alimlərindən olan əl-Mufidə hamilik edən, ona dəstək verən də məhz Adud əd-Dövlə ləqəbli Fənna Xosrov idi. əl-Mufidə xüsusi qayğı və ehtiram göstərərdi, hətta deyilənə görə "onu öz evində ziyarət edərdi, xəstələndikdə ona baş çəkərdi."[1378] Bir sözlə buveyhi dövlətinin tarix meydanına çıxması imami şiəliyi üçün bir dönüş nöqtəsi oldu; özlərinin nə qədər imami şiələri olmaqları mübahisəli olsa da buveyhilər Bağdadda imami şiələrini digərlərindən üstün tuturdular.[1379] Şiələrin məhşur dörd hədis kitabından üçü məhz bu dönəmdə qələmə alınıb və işıq üzü görüb. Bu dönəmdə siyasi olaraq

---

[1375] İbn əl-Əsir, "əl-Kəmil fit-Tarix", 7/5; Dar əl-Fikr

[1376] əz-Zəhəbi, "Siyər Əaləm ən-Nubələ", 16/250;

[1377] əs-Saduq'un "əl-Hidəyə" kitabının müqəddiməsi, səh: 134-136;

[1378] İbn Həcər, "Lisənul-Mizən", 5/368;

[1379] Hussein Ali Abdulsater, "Shi'i Doctrine, Mu'tazili Theology: Al-Sharif Al-Murtada and Imami Discourse", səh: 16; Edinburgh University Press, Edinburgh, 2017

şiə təsirləri qonşu bölgələrin idarələrində də öz əksini göstərdi; Mosul və Hələbi kontrol edən Həmdani sülaləsi, Xorasandakı Səmani sülaləsi şiə təmayülü ilə yadda qalıb. Bu dönəmdə Misirdə fatimilər, Bəhreyndə qarmatilər və Yəməndə zeydilər öz dövlətlərini qurdular.[1380]

Mötəzili məzhəbinin imami şiələrinə təsirinin ən açıq göstəricilərindən biri də budur ki, imamilərdə ilk mütəkəllimlər hesab edə biləcəyimiz şəxslərdən bir çox məşhur şəxsiyyət daha əvvəl mötəzili olub, sonra imami şiəliyini qəbul etmişdilər. Bunların arasında Əbu İsa əl-Vaqqar (h. 247), İbnur-Ravəndi (h. 245), Əbu Muhəmməd əl-Həsən bin Musa ən-Növbəxti (h. 310), Əbu Cəfər Muhəmməd Abdurrahmən bin Qibə (h. 319), Muhəmməd bin Abdilləh bin Mumələk əl-Əsfəhəni və başqalarının adlarını çəkmək olar. Bunlardan bəzilərinin etiqadi məzhəbi bu günə qədər də mübahisəli olaraq qalmaqdadır. əl-Vaqqar'a gəldikdə onun haqqında Mir Damad əl-Əstrabadi yazır: "Əbu İsa əl-Varraq — onun adı Muhammməd ibn Harun idi — bizim əshabımız arasında tanınmış mütəkəllimlərdən və fəzilət sahiblərindən biridir. Onun "əl-İməmə", "əs-Səqifə", "əl-Hukmu alə Surati Ləm yəkun", "İxtiləfuş-Şia" və "əl-Məqalət" adlı kitabları vardır. Nəcəşi onun tərcüməsində bu əsərləri qeyd etmişdir. Aləmul-Huda və Zul-Məcdyn Seyyid əş-Şərif əl-Murtəda "əl-Məsail", "əş-Şafi" və "ət-Təbbəniyyât" kitablarında və başqa çox əsərlərində tez-tez ondan nəql edir, onun sözünü əsas tutur, fikrinə arxalanır və çox zaman belə deyir: "Əbu İsa əl-Varraq əl-Məqalət adlı kitabında belə demişdir..." Əshabımız da osmanilərə rəddiyyələrində Əbu İsa əl-Varraq'dan çoxlu sitatlar gətirirlər. Sünnilər isə ona şiddətlə buğz edirlər..."[1381] İbnur-Ravəndi kimi mötəzililər həmçinin məşhur mötəzili alimi ən-Nəzzam'ın tələbələri olublar. ən-Nəzzam özü də şiə fikirlərindən təsirlənmiş, hətta onları mənimsəmiş biri idi. əl-Bağdadi qeyd edir ki, "sonra ən-Nəzzam rafizi Hişəm bin əl-Həkəm ilə oturub durdu və ondan öyrəndi..."[1382] Əbu İshaq əl-Varraq və İbn ər-Ravəndi və onlardan sonra ən-Növbəxti ilə İbn Qibə ər-Razi kimi keçmiş mötəzili alimlər şiə məzhəbində imamiyyət etiqadını kəlam əsaslarına oturdan və bu yöndə şiələr üçün əqli arqumentləri sistemləşdirən şəxslərdən olublar. Əbul-Həsən əl-Əşari deyir ki, "Əbu İsa əl-Varraq və İbn ər-Ravəndi onlara (yəni imami şiələrinə) qoşuldular və onlar üçün imamət mövzusunda kitablar

[1380] Kohlberg, "In Praise of the Few", səh: 183;
[1381] əl-Əstrabadi, "ər-Ravaşih əs-Səməviyyə", səh: 93;
[1382] əl-Bağdadi, "əl-Fərq beynəl-Firaq", səh: 119; Məktəbətu İbn Sina

yazdılar."[1383] Qeyd etmək lazımdır ki, artıq üçüncü əsrdə yazmış mötəzili alimləri şiələrin arasında mötəzililərdən təsirlənmə hallarını müşahidə edirdilər. Misal üçün İbnul-Xayyət belə bir şahidlik edir: "Məgər Yer üzündə Allahın surət olduğunu deməyən, bu barədə rəvayətlər rəvayət etməyən, bunun üçün öz imamlarından hədisləri dəlil gətirməyən bir rafizi olubmu heç? Aralarında yalnız əvvəllər mötəzililərə yoldaşlıq etmiş və tövhid inancında olmuş kəslər istisnadır ki, onları da rafizilər özləri öz sıralarından çıxarıblar!"[1384] Əbul-Hüseyn əl-Xayyət isə daha əvvəl də qeyd etdiyimiz kimi bağdadlı mötəzililərin böyüklərindəndir və hicri üçüncü əsrdə yaşayıb. Şiələrin böyük alimlərindən əl-Mufid yazır ki, onun zamanında bir hənəfi mötəzili alimi bağdadlı bir şiə fəqihi haqqında yazırdı ki, "o, kəlam elmini mötəzili şeyxlərimizdən oğurlamışdı və bu səbəblə də öz tayfası içində fəhminə görə seçilmişdi."[1385] Hətta imami şiələrindən bir qrupun bunu etiraf etdiklərini görürük. əl-Mufid hekayələrindən birində yazır ki, "imamilərdən hədis əhlindən bir camaatı" belə deyərkən görüb: "Təşbihi nəfy etməyi biz mötəzililərdən götürmüşük."[1386] Mötəzilənin alimləri arasından şiələri özlərinə yaxın bilən, onlarla birləşməyə çalışanlar da olub. əl-Qadi Abdulcəbbar deyir: "Muhəmməd bin Əbi Ömər əl-Bəhili dedi: "Mənə çatan xəbərə görə Əbu Əli əl-Cibəi əl-Askər şəhərində mötəzililər ilə şiələri birləşdirmək istəyirdi və deyirdi: "Onlar bizə tövhid və ədl babında müvafiq oldular, bizimlə onların ixtilafı sadəcə imamət məsələsindədir, ona görə də birləşin ki, bir güc olasız!"."[1387] Bu, mötəzililər ilə şiələr arasında etiqad babındakı yaxınlıqdan xəbər verir. Buna şahidlik edən daha bir tərəf budur ki, şiə alimlərindən bir çoxu öz məzhəblərini "ədl və tövhid" məzhəbi adlandırıblar. Onların öz məzhəblərini "ədl və tövhid" məzhəbi adlandırmaqları qəribə səslənməməlidir. Əsədullah ət-Tustəri qeyd edir ki, qeybə çəkilmiş imamın məzhəbi mütləq "ədl və tövhid əhlinin məzhəbi olmalıdır…"[1388] Ədl və tövhid məzhəbi isə yuxarıdakı sitatdan

---

[1383] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", səh: 64;

[1384] əl-Xayyət, "Kitəb əl-İntisar var-Raddu alə İbn ər-Ravəndi əl-Mulhid", səh: 144; əd-Dar əl-Arabiyyə lil-Kitəb, Beyrut, 1413

[1385] əl-Mufid, "əl-Məsəil əs-Sağaniyyə", səh: 41; əl-Mutəmir əl-Aləmi, 1413

[1386] əl-Mufid, "əl-Hikəyət", səh: 77;

[1387] "Fədlul-İtizəl va Tabəqat əl-Mutəzilə", səh: 291; əd-Dar ət-Tunisiyyə, 1974

[1388] ət-Tustəri, "Kəşful-Qina an Vucuh Hucciyyətil-İcmə", səh: 99; Muəssəsətu Al əl-Beyt, Qum, 1980

anladığımız kimi mötəzililər ilə şiələr arasındakı ortaq məzhəbdir və tarixən mötəzililərin öz məzhəblərinə verdikləri ad olub.

Orientalist alimlər də şiələr ilə mötəzililər arasındakı bu əlaqəni görüblər. Alman orientalist Adam Mez yazır ki, "teoloji olaraq şiələr mötəzililərin varisləridir; mötəzililərin hədis yönümlü olmamaqları xüsusilə onlar üçün əlverişli idi."[1389] Dwight Donaldson məsumluq etiqadı haqqında yazarkən qeyd edir ki, "şiə mütəkəllimlərin bu etiqad üçün dəlilləri gətirmək üslublarında mötəzililərə xarakteristik olan dəlilləndirmədəki rasionalizmin təsirini görə bilirik."[1390] Etan Kohlberg yazır ki, "doqquzuncu əsrdə imami şiəliyi, ən mərkəzi təlimi "tövhid və ədalət" olan mötəzili məktəbinin fikirlərini mənimsəməyə başladı."[1391] Lakin Kohlberg əlavə edir ki, bu təsir qarşılıqlı idi; xüsusilə də Bağdad şəhərində bir sferada fəaliyyət göstərmiş bu iki məktəb bir-birinə yaxınlaşırdılar, ona görə də Bağdad mötəzililəri Əlinin ən xeyirli səhabə olması rəyinə üstünlük verməyə başladılar, halbuki ən erkən mötəzililər bu fikirlər ilə tanınmırdılar. İmami şiələri təbii ki, bunu qəbul etmirlər; onlara görə imamilər mötəzilikdən heç cür təsirlənməyiblər. Şiə alimi Abdurrazzəq əl-Ləhici - misal üçün - mötəzililər ilə imamilər arasındakı bənzərliyi etiraf etsə də deyir: "Bilinməsi lazımdır ki, kəlam elminin əsaslarının əksərində imamilərin mötəziləyə müvafiq olmasının səbəbi mötəzililərin bunu fəlsəfə elmlərindən götürməsinə görədir, yoxsa imamilər öz üsullarını mötəzilənin elmlərindən almayıblar. Əksinə onların üsulu təkcə imamlardan götürülüb və onlar - saləvatullahi aleyhim - öz tələbələrinə kəlam elmini qadağan ediblər…"[1392] Livanda cəfəri məhkəməsinin qazilərindən Şeyx Abdullah Nimə firqələr arasındakı bənzərliklərdən danışarkən qeyd edir ki, bu bənzərlik "xüsusilə mötəzilə və şiələr arasında var idi; beləki onlardan hər birinin digərinə təsiri çox aşkardır…"[1393] O, bu bənzərliklərə misallar verərkən bunların arasında Axirət günündə Allahı görməyin mümkünlüyünü inkar etməyi, Quranın məxluq olması, qulların felləri, lütf qaydası, əslah qaydası, sifətlərin qədimliyini inkar etmək, onların elə Zatın özü

---

[1389] Mez, "The Renaissance of Islam", səh: 62; Jubilee Printing, Patna, 1937

[1390] Donaldson, "The Shi'ite Religion: A History of Islam in Persia and Irak", səh: 334; Lucaz & Company, London, 1933

[1391] Etan Kohlberg, "In Praise of the Few", səh: 179;

[1392] əl-Ləhici, "Şəvariqul-İlhəm fi Şərh Təcrid əl-Kələm", 1/50; Muəssəsətul-İməm əs-Sadiq, Qum, 1433

[1393] Nimə, "Hişəm bin əl-Həkəm", səh: 21;

olduğunu demək, şeylərin gözəlliyini və çirkinliyini əqlən dərk etmək məsələsini sadalayır.

Hicri 5-ci əsrin birinci yarısında yaşayıb yazmış ən görkəmli imami şiə alimləri ya əl-Mufid, ya əş-Şərif əl-Murtəda, ya da hər ikisinə tələbəlik etmişdilər.[1394] Ona görə də bu mərhələdən sonra gəlmiş imami şiələri məzhəb baxımından bu iki alimin qoyduqları izləri təqib ediblər. Bu iki alimə tələbəlik etmiş Şeyxut-Taifə ləqəbli Muhəmməd bin əl-Həsən ət-Tusi (385/995-460/1067) əş-Şərif əl-Murtəda'dan sonra şiə məzhəbinin şeyxi rolunu üstləndi. O, bu rolunda əl-Mufid ilə əl-Murtəda arasındakı ayrılma nöqtələrinə düzən gətirdi, bir çox məsələdə əl-Mufidin rəyi, digərlərində isə əl-Murtəda'nın rəyini dəstəklədi, məşhurlaşdırdı. Ona görə də əl-Alləmə əl-Hilli onu vəsf edərkən qeyd edir ki, "həm üsulda, həm də furuda əqidə məsələlərini təhzib edən odur."[1395] Səlcuqlular hicri 447-ci ildə Bağdadda buveyhilərin hakimiyyətinə son qoyduqlarında Şeyx ət-Tusi'nin kitabxanası və kürsisi yandırıldı. Təqib olunmaqdan ehtiyat edən ət-Tusi Kərbəlaya və sonra Nəcəfə köçdü və orada bu günə qədər də davam edən elmi hövzənin əsasını qoydu.[1396] ət-Tusi yazdığı təfsir kitabının müqəddiməsində nə üçün belə bir təfsir kitabını yazmağa ehtiyac olduğunu izah edir və təəssüf edərək deyir ki, "nə keçmişdə, nə də müasir zamanda əshabımızdan Quranın tamamının təfsirini ehtiva edən bir kitab görməmişəm." Daha sonra digər təfsir kitablarına toxunur, onların içində ət-Tabəri kimi təfsirlərin uzunluğundan şikayət edir, əz-Zəccac və əl-Fərra'nın təfsirlərinin yalnız erab və sərf elminə həsr olduğundan narazılıq edir. Lakin xüsusilə iki təfsir kitabından razılığını ifadə edərək yazır: "Təfsirdə gözəl və ortaölçülü yol tutmuş ən doğru kəslər Muhəmməd bin Bəhr Əbu Muslim əl-Əsfəhəni və Əli bin İsa ər-Rumməni'dir, beləki onların kitabları bu mənada yazılmış ən doğru kitablardır…"[1397] Hər iki alim mötəzili məzhəbinin təmsilçiləridir və ət-Tusi'nin öz təfsirində belə bu iki alimə üstünlük verməsi imamiyyə məktəbinin o dönəmdə nə qədər mötəzili ekolu ilə yaxından bağlı olduğunun göstəricilərindəndir.

---

[1394] Farhad Daftary & Gurdofarid Miskinzoda, "The Study of Shi'i İslam: History, Theology and Law", səh: 476; Tauris, London, 2014

[1395] əl-Hilli, "Xuləsatul-Əqval", 1/249; Muəssəsətu Nəşr əl-Fəqahə

[1396] "Məşari ət-Təcdid val-İslah fil-Həvzə əl-İlmiyyə", səh: 36; Beyrut, 2017

[1397] ət-Tusi, "Təfsirut-Tibyan", 1/1-2;

Şiələrdə üsul və ictihad mədrəsəsi formalaşdıqda Qum alimləri tərəfindən təmsil olunan hədis məktəbi ilə üsul məktəbi arasında fərqlər ortaya çıxmağa başladı. **Bu fərqlərdən biri** özünü hədis ravilərinə verdikləri hökmlərdə göstərirdi. Misal üçün ən-Nəcəşi və İbn əl-Ğadəiri kimi şiə alimləri əl-Mufəddal bin Ömər əl-Cufi'ni "zəif", "məzhəbi fasid", "fikirlərində aşırı" hesab etdikləri halda, əl-Mufid onu etibarlı hesab edir. İkincisi isə kəlam elmində, xüsusilə isim və sifət məsələlərində tamamilə fərqli yanaşma göstərmələrində bunu görürük. Burada ən aşkar fərqlərdən biri budur ki, "kəlamlaşma" prosesindən keçən şiələr keçmişin ənənəsini təşbihdə ittiham edirdilər. Misal üçün üsuli mədrəsəsinin ən məşhur nümayəndələrindən biri olan əş-Şərif əl-Murtəda qumlu şiələri ittiham edərək yazırdı: "Qummilərdən heç birinə istisna qoymadan - yalnız Əbu Cəfər bin Bəbəveyh müstəsna - hamısı dünən təşbih və cəbr etiqadında idilər və onların yazıları və kitabları buna şahidlik edir, bunu dilə gətirir."[1398] Hətta Əbu Cəfər bin Bəbəveyh belə tam bir şəkildə şiə mütəkəllimlərə müvafiq deyildi. Misal üçün o, qulların fellərini Allahın yaratdığını dediyi halda, əl-Mufid açıq şəkildə etiraz edir və deyir: "Muhəmmədin ailəsindən (sabit olan) doğru rəy budur ki, qulların fellərini Allahu təalə yaratmır…"[1399] əl-Mufid'in rəyindən mötəzili məzhəbinə doğru bir dəyişikliyin baş verdiyini görürük.

Ortadakı daha bir fərq əqli dəlillərdən istifadə etmək dərəcəsində özünü göstərirdi. Qum şəhərinin mühəddisləri yoğun bir şəkildə istinbat və ictihadla məşğul deyildilər. Əqli dəlillərin ən geniş şəkildə işləndiyi kəlam elmində belə Qum məktəbi özünü xəbər və nəql mərkəzli bir mədrəsə kimi göstərirdi. Əbu Cəfər əs-Saduq misal üçün "ət-Tövhid" kitabında etiqadi məsələləri yoğun bir şəkildə rəvayətlər üzərindən ərz edir. Bu məsləkdə öz sələfi Əbu Yaqub əl-Kuleyni'nin "Usul əl-Kəfi" kitabına tabedir, beləki hər ikisi də əqidənin ən ağır mövzularında sadəcə rəvayətləri zikr etməklə kifayətləniblər. əs-Saduq, onun atası, əl-Kuleyni, əl-Bərqi, əs-Saffər, əl-Himyəri və başqaları onlara nisbət olunan kitablarda bu üslubdan kənara çıxmırlar. Bu mədrəsənin içində kəlam elmində nəzəri dəlillərlə ən çox məşğul olmuş zat əs-Saduq olub. Bununla belə əl-Mufid onu nəzəri dəlillərdən, əqli istidlələdən uzaq biri olmaqla ittiham edir. İradə və məşiə məsələsinə toxunan əl-Mufid bu məsələdə əs-Saduq'un ziddiyyətli və ixtilaflı olduğunu bəyan edərkən yazır: "Bunun səbəbi isə budur ki, o, ixtilaflı

---

[1398] əl-Murtəda, "Rasəil əş-Şərif əl-Murtəda", 3/310; Dar əl-Quran əl-Kərim, 1405, Qum
[1399] əl-Mufid, "Təshih İtiqadət əl-İməmiyyə", səh: 42

hədislərin zahiri ilə əməl edib, nəzəri dəlilləri istifadə etmək rəyində olanlardan deyildi…"[1400] əl-Mufid daha sonra əs-Saduq'un mənhəcini "müxtəlif qövllərə əsaslanmaq, ravilərə təqlid etmək" olaraq dəyərləndirir. əl-Mufid'in tələbəsi əl-Murtəda əş-Şərif bu məktəbi təmsil edən "hədis alimlərini" elmsizlikdə ittiham edir. "Əshabımızdan olan hədis alimlərinin kitablarını boş ver" - əl-Murtəda deyir: "Onlarda bu alimlərin arasında hüccət gətirən və hüccətin nə olduğunu bilən yoxdur. Kitabları da hüccətə əsaslanmaq üçün yazılmayıb."[1401] Beləliklə də kəlam elmində əqli və nəzəri dəlillərə qabarıq şəkildə əsaslanmaq yeni bağdad məktəbini qumluların hədis məktəbindən ayırırdı. Əqidə məsələlərində zənn ifadə edən əhəd hədislərə əsaslanmamaq da bu yeni mənhəcin bir hissəsi idi. Hətta nəinki əqidə məsələlərində, fiqh məsələlərində belə əhəd hədislər əvvəlki etibarını itirmişdi. əl-Mufid bunu "əl-Məsəil əs-Səraviyyə" kitabında Əbu Cəfər əs-Saduq'un rəvayət etdiyi hədislər barəsində yazır ki, "onların hamısı ilə əməl etmək vacib deyildir…çünki əhəd xəbərlərdir, nə elm, nə də əməli gərəkdirməz…" Eyni yerdə "hədis əhlindən" danışaraq buyurur ki, onların nəql etdikləri içində nəyin elm ifadə etdiyini, nəyin isə elm ifadə etmədiyini ayıra bilməməkləri onların "nəzəri metodları tərk etməklərinə, nəzəri dəlillərə yox, xüsusilə nəqllərə, ravilərdən eşitdiklərinə və təqlidə əsaslanmaqlarına görədir."[1402] Zənn ifadə edən əhəd xəbərlər haqqında əş-Şərif əl-Murtəda'nın məzhəbi məlumdur və məşhurdur; o, bu məsələdə şeyxi əl-Mufid'dən də sərt olub. Qeyd etməliyik ki, bu ixtilaf əhlüs-sünnət ilə mötəzililər arasındakı ixtilafa bənzəyir. Lakin Şeyx ət-Taifə ət-Tusi bu mövzuda, yəni əhəd xəbərlərin hüccət olması məsələsində yeni bağdad mədrəsəsi ilə qədim əxbari mədrəsəsi arasında orta bir yol tutur, onun başlatdığı Nəcəf hövzəsi əhəd xəbərlərə mütləq şəkildə etimad etmək ilə onları tamamilə rədd etmək arasında təfsilatlı bir mövqeni təbliğ edirdi. Lakin əş-Şərif əl-Murtəda'nın təsiri hələ bir müddət özünü göstərdi, yalnız yeddinci əsrdən başlayaraq şiə alimləri ət-Tusi'nin rəyi ilə qane oldular.[1403]

Qum mədrəsəsini ayıran bir başqa xüsusiyyət onların aşırı etiqadlara qarşı mübarizə aparmaqları olub. İmamlar haqqında etiqadlarında aşırı olmaqda ittiham olunan kəsləri şəhərdən qovarmışlar. Əhməd bin Muhəmməd bin Xalid əl-Bərqi, Əbu Said Səhl

---

[1400] əl-Mufid, "Təshih İtiqadət əl-İməmiyyə", səh: 49

[1401] "Rasəil əl-Murtəda", 1/26-27;

[1402] əl-Mufid, "əl=Məsəil əs-Səraviyyə", səh: 72-73;

[1403] Hubbullah, "Nəzariyyətus-Sunnə fil-Fikr əl-İməmi əş-Şii", səh: 160-161;

bin Ziyəd əl-Ədəmi ər-Razi, Hüseyn bin Abdilləh əl-Qummi, Əbu Cəfər Muhəmməd bin Əli əs-Sayrafi və başqalarını bu səbəblə şəhərdən qovub çıxarmışdılar. əl-Mufid yazır: "Əbu Cəfər Muhəmməd bin əl-Həsən bin əl-Valid'dən imamlar haqqında qüsur etiqadına aşkar dəlalət edən və heç cür müdafiə oluna bilməyəcək bir hekayə eşitmişik; belə dediyi hekayət olunur: "Aşırılığın ilk dərəcəsi peyğəmbərdən və imamdan səhv etmək imkanını rədd etməkdir." Əgər bu hekayə ondan səhihdirsə o zaman o, qummilərin alimlərindən və şeyxlərindən olsa belə qüsur etiqadında olub."[1404] Bu bizə onu göstərir ki, əs-Saduq'un təmsil etdiyi Qum mədrəsəsi ilə əl-Mufid'in təmsil etdiyi Bağdad mədrəsəsi arasında ciddi bir fərq var idi. əs-Saduq deyir: "Ğulatlar və mufavvid'lər - Allah onlara lənət etsin! - peyğəmbərin - salləllahu aleyhi va əlihi - səhv edə biləcəyini inkar edirlər… Şeyximiz Muhəmməd bin əl-Həsən bin Əhməd bin əl-Valid - rahiməhullah - deyərdi: "Aşırılığın birinci dərəcəsi, peyğəmbərin - salləllahu aleyhi va əlihi - səhv edə biləcəyini rədd etməkdir; əgər bu mənada gəlmiş xəbərləri inkar etmək icazəli olsaydı o zaman bütün xəbərləri inkar etmək icazəli olmalı idi, halbuki bunu etməklə dini və şəriəti batil çıxarmış olursan."[1405] Şiə kitablarındakı xəbərlərdə peyğəmbərin - salləllahu aleyhi va səlləm - namazda səhv etməsinə dair xəbərlər səhih isnadlar ilə gəlib. Lakin şiə alimləri bu səhih xəbərləri etiqadi səbəblərə görə qəbul etmirlər. Əbul-Qasim əl-Xoyi yazır ki, "bu xəbərlər sənədləri səhih olsa da məzhəbin üsuluna müxalif olduqları üçün özlərində təsdiq oluna bilməzlər…"[1406] Beləliklə də Qum mədrəsəsinin inkar etdiyi və əleyhinə çalışdığı aşırı etiqadların üsuli məktəbində normallaşdığını görürük. İmamların və peyğəmbərlərin təbliğdən başqa işlərdə də məsum olduğunu demək Qum məktəbində məşhur olan bir etiqad deyildi, əksinə o dönəmdə belə bir etiqad xəta hesab olunurdu, bu etiqad sahiblərini lənətləyirdilər. Məgər əs-Saduq və şeyxi İbnul-Valid şiə məzhəbindən bu dərəcədə cahil idilərmi?!

---

[1404] əl-Mufid, "Təshih İtiqadət əl-İməmiyyə", səh: 135-136;

[1405] əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", səh : 359-360;

[1406] əl-Xoyi, "Kitəb əs-Salət", 6/329;

## Əxbarilər və üsulilər

Yuxarıda bizim qeyd etdiyimiz kimi erkən şiə alimləri və raviləri ümumilikdə "əxbari" qoluna aid edilə bilərlər. Altının xəttini cızaraq qeyd etdik ki, bu "əxbarilər" səfəvi dönəmində formalaşmış "əxbarilər" ilə eyni məktəb olmasa da hər ikisini birləşdirən ortaq tərəflər vardır; hər şeydən əvvəl hər iki məktəb "xəbər təmərküzlü" məktəbdir, hər iki məktəb istər üsulu, istərsə də furunu - qeydsiz, şərtsiz - xəbərlərdən götürməyi doğru hesab edirlər və rasional arqumentləri üsulda dəlil hesab etmirlər. Bu o demək deyildir ki, əxbarilərin kitablarında rasional arqumentlər yoxdur, lakin əxbarilərin kitablarında qarşılaşdığımız əqlə dayanan arqumentlar etiqadların və hökmlərin təməlini təşkil etmir, sadəcə olaraq etiqadların və hökmlərin təməlini təşkil edən xəbərləri dəstəkləmək üçün gətirilən arqumentlərdir. Üsulilərin istifadə etdikləri əqli arqumentlər isə təməl arqumentlərdir, hətta bu arqumentlər üzərindən onlar bəzi xəbərləri tamamilə inkar edə bilirlər.

Şiələrdə mövcud olan hər iki qol bir-birini sonradan ortaya çıxmış firqə olmaqda ittiham edirlər. Üsulilərə görə əxbarilik hicri on birinci əsrin əvvəllərində ortaya çıxıb və bu məktəbin həqiqi banisi hicri 1033-cü (m. 1624) ildə vəfat etmiş Muhəmməd Əmin əl-Əstərabadi olub.[1407] əl-Əstərabadi gəncliyini Nəcəf və Şirazda keçirmişdi, daha sonra Mədinə və Məkkə şəhərlərində yaşayıb. Oxuyub maraq saldığı sahələr çox olub; kəlam elmi, məntiq, tibb, ədəbiyyat oxuyub, lakin daha çox hədis və üsulul-fiqh elmləri ilə məşğul olub. O, elmi həyatının birinci mərhələsində ictihad məktəbinə aid idi, lakin sonra fikirlərini dəyişdi. Möhtəmələn ona təsir edən müəllimi Muhəmməd bin Əli əl-Əstərabadi (vəfatı h. 1028) olub və məhz o, öz tələbəsinə "əxbarilərin məzhəbini bərpa edəcəyinin" müjdəsini verərək onu ruhlandırmışdı. Muhəmməd Əmin xəbər verir ki, o, Məkkəyə gəlmədən əvvəl Mədinədə bir neçə il təfəkkür etmiş, sonra Məkkəyə gəldikdə orada 1031-ci ildə "əl-Fəvaid əl-Mədəniyyə" kitabını yazıb. Əxbarilər üsuliləri sonradan ortaya çıxmış firqə hesab edirlər, sünnilərin və mötəzililərin təsiri ilə formalaşmaqda ittiham edirlər. əl-Əstərabadi'yə görə imamlar və onların tələbələri əxbarilər olublar. Əxbarilik xəttini ilk tərk edən şiələr - onun nəzərində - İbn Əbi Aqil əl-Uməni və İbn əl-Cuneyd əl-İskəfi olub. O həmçinin İbn əl-Mutahhər əl-Hilli'ni də ittiham edir; onu sünni hədis elminin

[1407] əs-Subhəni, "əş-Şeyx əl-Ənsari: Raid ən-Nəhda əl-İlmiyyə əl-Hədisə", səh: 21;

elementlərini şiəlikdəki rəvayət sisteminə idxal etməkdə günahlandırır.[1408] O, "əl-Fəvaidul-Mədəniyyə" kitabında "əxbarilərin" yeni olmadıqlarını göstərmək üçün bəzi qaynaqlara müraciət edir. Doğrudur ki, tarixi qaynaqlarda şiələrin arasında "əxbari" adı ilə tanıdılan bir cərəyan olduğu sabitdir, bunu həm sünni, həm də şiə qaynaqlarda oxuya bilirik. Sünni qaynaqlara gəldikdə misal üçün Əbul-Fəth əş-Şəhristani yazır: "Onlar (şiələr) ilk əvvəl üsulda imamlarının məzhəbi üzərində idilər, sonra imamlarından gələn rəvayətlərdə ixtilaf ortaya çıxdıqda və zaman keçdikcə hər bir firqə özü üçün bir yol seçdi və imami şiələrin bəziləri mötəzili - ya vaidiyyə, ya da təfdiliyyə - oldular, bəziləri də əxbarilər - ya müşəbbihə, ya da sələfilər - oldular."[1409] Digər sünni alimi əl-Adud əl-İci deyir: "(İmami şiələrdən) mütəaxxir olanlar ya mötəzililərin, ya da əxbarilərin məzhəbi üzərindədirlər.."[1410] əş-Şərif əl-Curcəni bu sözləri şərh edərkən "əxbariləri" belə vəsf edir: "Mütəşabih xəbərlərdə varid olanların zahirinə etiqad edirlər."[1411] Daha bir şahidlik sünni alimlərindən Fəxruddin ər-Razi'dən gəlir. O, əhəd xəbərin hüccət olması haqqında danışarkən yazır: "İmami şiələrə gəldikdə isə onlardan olan "əxbarilər" - ki, qədim zamanda şiələrin çoxu onlardan idi - furuat bir kənarda qalsın, hətta üsulud-din məsələlərində belə yalnız öz imamlarından rəvayət etdikləri xəbərlərə əsaslanırlar. Üsulilərə gəldikdə isə Əbu Cəfər ət-Tusi bu məsələdə bizimlə razılaşır, bunu inkar edənlərdən əl-Murtəda və ona tabe olmuş az bir nəfərdən başqa heç kim qalmayıb."[1412] Hətta əş-Şəhristani deyir: "Onlardan olan əxbarilər ilə kəlamilər arasında qılınc və təkfir vardır."[1413] Bu sözlər şiələr ilə iç-içə yaşamış bir tarixçinin şahidliyidir. əş-Şəhristani yaşadığı və səyahət etdiyi ərazilərdə müxtəlif şiə firqələri ilə çox sıx kontaktda olmuş, onlarla müzakirələrdə iştirak etmişdi.[1414] Şiə qaynaqlarına gəldikdə isə əl-Allamə əl-Hilli yazır: "İmamilərə gəldikdə isə, onlardan olan əxbarilər həm dinin üsulunda, həm də furusunda yalnız imamlardan -

---

1408 Etan Kohlberg, "In Praise of the Few", səh: 522-523;

1409 əş-Şəhristani, "əl-Miləlu van-Nihəl", 1/165; Muəssəsətul-Hələbi, 1431

1410 əl-İci, "əl-Məvaqif fi İlm əl-Kələm", səh: 423; Aləmul-Kutub, Beyrut

1411 əl-Curcəni, "Şərhul-Məvaqif", 8/424; Darul-Kutubil-İlmiyyə, Beyrut

1412 ər-Razi, "əl-Məhsul fi İlm Usul əl-Fiqh", 4/384; Muəssəsətir-Risələ, Beyrut, 1992

1413 əş-Şəhristani, "əl-Miləl van-Nihəl", 1/172; Muəssəsətul-Hələbi, 1431

1414 əş-Şəhristani "əl-Miləl van-Nihəl" kitabını Xorasandakı əmirlərdən biri olmuş, şiə təmayüllü Əli bin Cəfər əl-Musəvi üçün həsr etmişdi. Bunu "Musaraatul-Fələsifə" kitabının müqəddiməsində (səh: 13-14) özü xəbər verir. əş-Şəhristani özü bəzi tarixçilər tərəfindən şiəliyə meyl etməkdə ittiham olunub.

aleyhissələm - rəvayət olunmuş əhəd xəbərlərə əsaslandılar. Onlardan olan üsulilərə gəldikdə isə, misal üçün Əbu Cəfər ət-Tusi və başqaları əhəd xəbəri qəbul etmək rəyi ilə razılaşdılar və bunu əl-Murtəda və davamçılarından başqa heç kim inkar etməyib."[1415] Bəziləri Şeyx əl-Mufid'in onlara qarşı kitab yazdığını deyiblər. "Məqabis əl-Ənvar fir-Raddi alə Əhl əl-Əxbar" adlanın bu kitabın adından məlum olduğu kimi kitab "əxbar əhlinə", yəni əxbarilərə rədd olaraq yazılıb.

Əxbarilərin lideri əl-Əstərabadi məhz əş-Şəhristani'nin, əl-İci'nin və əl-Hilli'nin sözlərini gətirərək əxbariliyin qədimdən mövcud olduğunu göstərməyə çalışır. Bir başqa əxbari alimi Muhəmməd ət-Tahir əl-Qumi də yazır: "İmami şiələrinə, qurtulmuş firqəyə gəldikdə isə pak ailənin nümayəndələri olan imamlara tabe idilər, həm üsulda, həm də furuda onların əsərlərini izləyirdilər. Bu hal bu ümmətin Mehdisinin böyük qeybətə çəkilməsi, kiçik qeybətinin günlərinin bitməsinə qədər davam etdi, bu zaman şiələr çobanları itmiş qoyun sürüsünə döndülər, otlaqlarında heyrətə düşdülər, yollarını azdılar; beləliklə də onlardan kimisi mötəzilənin yolu ilə getdilər, kimisi də imamların əsərlərini izləməyə və onların xəbərlərinə tabe olmağa davam etdilər…"[1416] Əgər diqqət edərsək görərik ki, müasir əxbarilər öz kitablarında üsuliləri mötəzililərin uzantıları hesab edirlər, bu isə o anlama gəlir ki, onlar üsuliləri əvvəlki şiələrin yolundan sapmaqla günahlandırırlar. Üsulilər isə təbii ki, bununla razılaşmırlar. Cəfər əs-Subhani etiraz edir və əl-Əstərabadi'nin istifadə etdiyi tarixi şahidliklərin onun iddiasını təsdiqləmədiyini deyir. Çünki - əs-Subhani'yə görə - əş-Şəhristani və əl-İci'nin dedikləri etiqadda mütəşabih xəbərlərə, Allahın sifətləri məsələsinə aiddir, amma müasir əxbarilərin metodu isə əsasən furuatda üsulilərdən fərqlənir. əl-Hilli'dən gətirilmiş nəqlin isə əhəd xəbərin hüccət olub olmaması məsələsinə aid olduğuna diqqət çəkir.[1417] Burada əs-Subhani ilə razılaşmaq lazımdır ki, əl-Əstərabadi'nın çıxardığı əxbarilik ilə qədimdəki əxbarilik eyni olmayıb, çünki müasir əxbarilik ümumiyyətlə xəbərlərin isnadını və ya mətnini tənqid etməyin əleyhinədir, onlar məşhur hədis kitablarında gəlmiş bütün xəbərləri olduğu kimi qəbul edirlər, onların hamısını imamlardan gəlmiş mötəməd xəbərlər hesab edirlər. Sadəcə olaraq

---

[1415] əş-Şəhid əs-Səni, "Məalimud-Din va Məlәzzul-Muctəhidin", 1/191; Muəssəsətu ən-Nəşr əl-İsləmi, Qum,

[1416] Anzali & Gerami, "Opposition to Philosophy in Safavid Iran", səh: 70-71; Brill, Leiden, 2017

[1417] əs-Subhəni, "əş-Şeyx əl-Ənsari: Raid ən-Nəhda əl-İlmiyyə əl-Hədisə", səh: 22-24;

problemli xəbərləri "təqiyyə" prinsipi ilə izah etməklə problemi çözməyin kifayət edəcəyinə inanırlar. Qədim əxbarilərə gəldikdə isə onların arasında raviləri ittiham edib, hədislərini inkar edənlər çox olublar. Şeyx Murtəda əl-Mutahhari xüsusilə maraqlı bir paralelə diqqət çəkir; şeyxi Hüseyn əl-Burucərdi'dən nəql edir ki, şiə dünyasında əxbarilik fikrinin intişar etməsi Avropada rasionalizmi inkar edən empirisizm hərəkatının canlandığı bir dönəmə təsadüf edir. "Bütün bunlar" - əl-Mutahhəri əlavə edir - "Səfəvi İran ilə Avropa dövlətləri arasında çox güclü əlaqələr olduğu bir zamanda baş verdi."[1418] Muhəmməd Baqir əs-Sadr da Avropadakı anti-rasionalizm cərəyanı ilə əxbarilik arasında bir paralelin olduğuna diqqət çəkir; hər iki cərəyanın "əqlə qarşı hücum çəkməklə, hislərə dayanmadığı təqdirdə əqlin hökmlərini ləğv etməklə" xarakterizə edir.[1419] Maraqlıdır ki, alman islamşünas Thomas Bauer "A Culture of Ambiguity" kitabında sünnilər arasında formalaşmış sələfilik hərəkatının Avropanın kolonial güclərindən təsirləndiyini deyir. Burada paralellər nə qədər maraqlı olsa da bizim bu fikirlə razılaşmağımız mümkün deyildir, müəyyən dərəcədə bir təsirin olması mümkündür, lakin bunu əsas səbəb kimi göstərmək yalnış olardı. Şiə alimlərindən Şeyx Muhəmməd ət-Təqi iddia edir ki, qədimdəki əxbariləri müctəhidlərdən ayıran tək bir xüsusiyyət onların ictihad etməməkləri olub; "onlarla üsulçular arasındakı ixtilaf yalnızca fiqhi təfriatlardakı bacarıqda, külli qaydalarla bağlı nəzəri biliklərinin gücündə və bu qaydalar üzərində furuat bina etmək qabiliyyətində olub." Bu əxbarilər xəbər raviləri olublar, nasları toplayıblar və bu xəbərlərin məzmunlarına dalmaq onların işləri olmayıb, "əksinə əksər hallarda rəvayət etdiklərinə mütabiq olaraq fətva verər və xəbərlərin mətnlərinə müvafiq şəkildə hökm edərdilər, onların çoxu nəzər əhli olmayıb, elmi məsələlərin dərinliklərini bilməyiblər… Belələri xəbərlərdə haqqında məlumat olmayan məsələlərə çox zaman toxunmazdılar və "əxbarilər" olaraq tanınanlar bunlardır."[1420] Muhəmməd Baqir əs-Sadr bu izahla razılaşır və fərqin təkcə ictihad əhliyyətində olduğuna diqqət çəkir.

Bu kimi izahlar əslində işin haqqını tam bir şəkildə vermir. Etiraf etmək lazımdır ki, qədimdə üsulilər ilə əxbarilər arasında ciddi bir fərq mövcud olub, müasir şiə alimləri bu fərqləri nə qədər xəfifləşdirməyə

---

[1418] əl-Mutahhəri, "əl-İsləm va Mutətallibət əl-Asr", səh: 90-91;

[1419] əs-Sadr, "əl-Məalim əl-Cədidə lil-Usul", səh: 61"

[1420] Muhəmməd Baqir əs-Sadr, "əl-Məalim əl-Cədidə lil-Usul", səh: 85; Darut-Təarif lil-Mətbuat, Beyrut, 1989

çalışsalar da bunun ciddiliyini göstərən tarixi şahidlikləri yalanlamaq mümkün deyildir. Əxbarilər və üsulilər arasındakı fərqdən danışan ən qədim şiə mənbələrindən biri də hicri altıncı əsrdə yaşamış Abdulcəlil əl-Qazvini ər-Razi'nin yazdığı "ən-Nəqd" kitabıdır. Kitab fars dilində yazılıb və "Bədu Məsəlib ən-Nəvasib fi Nəqd Bədi Fədaih ər-Ravafid" kitabın tam adıdır. Şiəliyi tərk edərək sünni olmuş bir müəllifin[1421] yazdığı "Bədu Fədaih ər-Ravafid" kitabında şiələrə qarşı yönləndilmiş ittihamlara cavab verməк məqsədi ilə yazılmış bu kitabda ittihamlardan bir çoxunu əl-Qazvini "əxbarilərə" nisbət edir və beləliklə də "əxbarilər" ilə "üsulilər" arasında fərq qoyur. Özünü də üsuli ənənəsinə nisbət edən əl-Qazviniyə görə həqiqi şiələrin çoxu üsulidir və o, əxbariləri zəlalət firqələrindən biri hesab edir. Kitabda verilən məlumatlardan maraqlı fərqlər ortaya çıxır. Beləki əl-Qazvini'yə görə üsulilər nə üsulda, nə də furuda əhəd xəbərləri hüccət hesab etmirlər, lakin əxbarilər belə bir fərq qoymurlar, onlara görə istər üsulda, istərsə də furuda əhəd xəbərlər ilə əməl olunar.[1422] əl-Qazvini'nin üsulilərə nisbət etdiyi rəy dəqiq deyildir, çünki bu məsələdə üsulilər arasında ittifaq yoxdur. Doğrudur ki, üsul məsələlərində onlar mötəzililərə müvafiq olaraq əhəd hədisi hüccət hesab etmirlər, amma furu məsələlərinə gəldikdə isə əhəd hədisi hüccət görməyənlər əl-Murtəda əş-Şərif və ona tabe olanlardır, üsulilərin hamısı bu rəydə deyillər. Qəribədir ki, müasir əxbarilər özləri ilə üsulilər arasındakı fərqlərdən danışdıqda buna yaxın bir nöqtəyə toxunurlar. Əxbari alimlərdən Abdullah əs-Səməhici "Munyətul-Mumərisin" kitabında yazır: "Müctəhidlər əqidə məsələlərini Qurandan və hədisdən götürməyə icazə verirlər, hətta bəlkə də bəziləri fiqhin üsulu məsələlərini əhəd hədislərdən götürməyi qadağan edirlər, çünki üsulda dəlilin qəti olmasını şərt görürlər və əhəd xəbər qətiyyət ifadə etmir. Əxbarilər isə - daha əvvəl deyilənlərdən öyrəndiyin kimi - bunun əksini deyirlər."[1423] Burada təbii ki, üsulilərə qarşı bir mübaliğə vardır, çünki məlumdur ki, üsulilər Quranı etiqadda dəlil hesab edirlər. Lakin çox ehtimal ki, əs-Səməhici burada üsulilərin Quranı kəlam və fəlsəfə

---

[1421] Bəziləri onun Şihəbuddin ət-Tavarixi ər-Razi olduğunu, digərləri Əbul-Həsən və ya Əbul-Hüseyn əl-Basri olduğunu, bəziləri isə müəllifin hənəfi olduğunu deyirlər.

[1422] Mohammad Hadi Gerami, "The Socio-Political Aspect of Religious Terminologies in Medieval Iran: The Case of "Akhbari-Usuli" in Kitab al-Naqd Written by Abd al-Jalil Qazwini Razi", The Quarterly Journal of Iranian Islamic Period History, cild 12, say 27, səh: 29, Təbriz Universiteti, 2021

[1423] Andrew J. Newman, "The Nature of the Akhbari/Usuli DIspute in Late Safawid Iran. Part 1: Abdallah Samahiji's "Munyat al-Mumarisin", Bulletin of the School of Oriental and African Studies, cild 55, say 1, səh: 31; London Universiteti, 1992

arqumentlərinə tabe tutmaqlarını nəzərdə tutur. əl-Qazvini'nin qeyd etdiyi daha bir fərq budur ki, üsulilər şiə tayfasının icmasını və əqli dəlilləri Quran və sünnət ilə yanaşı təməl dəlillərdən hesab edirlər; beləliklə də üsulilərə görə bu dörd dəlil Quran, sünnət, icma və əql olur. Buradan anlaşılır ki, əl-Qazvini'nin qəsd etdiyi əxbarilərə görə icma və əql dəlil olmaz, yalnız Quran və sünnət dəlildir.[1424] əs-Səməhici də bunu, qeyd etdiyi siyahidəki qırx fərqdən ikincisi olaraq qeyd edir və deyir: "Müctəhidlər deyirlər ki, "bizə görə dəlillər dörddür: Kitab, sünnət, icma və əqlin dəlili. Əxbarilər isə Kitab və sünnətdən başqasını dəlil hesab etmirlər..."[1425]

Sözü gedən sünni müəllifin rafizilərə qarşı qaldırdığı ittihamlardan biri də Quranın təhrifi ilə bağlıdır. əl-Qazvini bu etiqadın üsuli şiələrə aid olmadığını, "ğulat" və "həşəvilərə" aid olduğunu deyir və kitabında "əxbariləri" həşəvilər ilə eyniləşdirdiyi bizə məlumdur. əs-Səməhici öz siyahısında əxbarilər ilə üsulilər arasında belə bir fərqi qeyd etmir. Lakin müasir tarixdə Quranın təhrifi ilə bağlı etiqadlar əxbari alimlərinin kitablarında mövcuddur. əl-Məclisi, Nemətullah əl-Cəzairi, Nuri ət-Tabrasi kimi təhrifə inanan alimlər əxbari ənənəsini təmsil edirlər. əs-Səməhici özü də onlardan biridir. Maraqlıdır ki, əş-Şərif əl-Murtəda üsuli məktəbinin ən böyük nümayəndələrindən biri olaraq bu məsələ haqqında danışdıqda Quranın təhrifi etiqadını "hədis əshabı" olaraq vəsf etdiyi tayfaya nisbət edir: "İmamilərdən və həşəvilərdən bu məsələdə müxalif olanların rəyi hesaba alınmaz və onlar hədis əshabından olan bir qövmə aiddir ki, zəif xəbərlər nəql ediblər və səhih olduğunu güman ediblər..."[1426] Hədis əshabı ilə şübhəsiz ki, xəbərlərin zahirinə bağlı olan şiələri qəsd edir. Lakin bunu yalnız əxbarilər ilə xüsusiləşdirmək xəta olardı. Belə görünür ki, Quranın təhrifi inancı şiələrdə qədimdir və buveyhilər dövründən əvvəlki zamana baxdıqda bu etiqadın şiələr arasında, hətta onlardan üsuli saya biləcəklərimiz arasında belə mövcud olduğunu görə bilərik. Şeyx əl-Mufid bu məsələni "Əvailul-Məqalət" kitabında müzakirə edir və Qurandan hansısa bir sözün çıxarılmasını, düşürülməsini imkansız hesab edir, eləcədə Qurana bütöv bir surənin əlavə edilə biləcəyini də rədd edir, bunu da qeyri-mümkün hesab edir. Lakin Qurana bir-iki kəlimənin və ya hərfin əlavə edilməsinə gəldikdə isə deyir: "Lakin ora (yəni Qurana) bir-iki kəlimənin, bir-iki hərfin əlavə edilməsi və buna bənzər icaz həddinə

[1424] Gerami, səh: 30;

[1425] A. Newman, səh: 24-25;

[1426] əl-Murtəda, "əz-Zəxira", səh: 363;

çatmayan, fəsahətli insanların əksəriyyətinin Quranın əsli sözləri ilə səhv sala biləcəyi həddə bir şeylərin artırılması mümkün ola biləcək növdəndir, lakin belə bir şey baş verdikdə Allahın bunu bildirməsi və bəndələrinə bu barədə haqqı bəyan etməsi labüddür. Bunun baş verdiyinə qərar vermirəm, əksinə bunun baş verməməsi və Quranın bundan salamat olması rəyinə meyl edirəm… Bu məzhəb, Quranda əlavənin və nöqsanın olması ilə bağlı Növbəxt oğullarından - rahiməhumullah - eşitdiklərimizə müxalifdir və imami şiələri içində mütəkəllimlərdən, fiqh və etibar əhlindən bir qrup bu rəyi götürüblər."[1427] Gördüyümüz kimi əl-Mufid Quranda əlavə və nöqsanın olması fikrini növbəxtilər kimi üsuli şiələrə nisbət edir, bunun həmçinin imamilərdəki bir qrup kəlamçılara da aid olduğunu deyir. Əxbarilər isə kəlam elmi ilə məşğul olmayıblar. Ona görə də Quranın təhrifi inancını yalnız əxbarilərə nisbət etmək xətalıdır, üsulilər arasında da bu fikir mövcud olub. əl-Mufid özü də - şahid olduğumuz kimi - bu məzhəbi qəti şəkildə inkar etmir, sadəcə olaraq əks görüşə meyl edir. Tələbəsi əş-Şərif əl-Murtəda isə təhrif məzhəbini "əshabımızdan hədis nəql edənlərə" nisbət edir və deyir: "Quranın nöqsanlı olması rəyini əshabımızdan yalnız hədis əhlindən bir qrup deyib ki, onlar nə dediklərini bilmirlər, dəbləri sadəcə hədisə təqlid etməkdir, rəvayətin içində nə varsa - haqq və ya batil olmasından asılı olmayaraq - ona təfəkkür etmədən, düşünmədən təslim olurlar."[1428] Molla Muhəmməd Mehdi ən-Nəraqi yazır: "Quranın dəyişdirilməsi və təhrifi məsələsində əshabımız arasında ixtilaf düşüb; əxbarilərin əksəriyyəti deyir ki, Quran təhrif olunub, ona əlavələr edilib, ondan düşürülüb. əs-Saduq, əs-Seyyid, ət-Tabrasi və müctəhidlərin əksəriyyəti isə bu rəydədir ki, Quranda bunlardan heç biri yoxdur."[1429] Həmçinin Mirzə Musa ət-Təbrizi Quranın təhrifi etiqadı barəsində yazır ki, "bu rəyi əxbarilər və həşəvilər qəbul ediblər, bu rəy əl-Kuleyni'dən, şeyxi Əli bin İbrahim əl-Qummi'dən və "əl-İhticəc" kitabının sahibi Əhməd bin Əbi Talib ət-Tabrasi'dən hekayət edilib. Üsulilər isə buna müxalif oldular və Quranda təhrifin baş verməsi rəyini inkar etdilər…"[1430] Şiə üsul alimlərindən Əli bin əs-Seyyid Nəqi ər-Radavi də buyurur: "Muhəmmədə nazil olanların hamısının mütəvatir (dəqiq şəkildə ötürülmüş) olması məsələsinə gəlincə, bunun izahı müşküldür.

---

[1427] əl-Mufid, "Əvailul-Məqalət", səh: 92; Darul-Kitəb əl-İsləmi, Beyrut, 1983

[1428] əş-Şərif əl-Murtəda, "Cəvab əl-Məsəil ət-Tarablusiyyət", 1/204-205 və 217

[1429] ən-Nəraqi, "Ənis əl-Muctəhidin", 1/193;

[1430] ət-Təbrizi, "Əvsəqul-Vasəil fi Şərh ər-Rasəil", səh: 91;

Quranda təhrif və naqisliyin baş verməsi məsələsində ixtilaf edilmişdir. Əxbarilərin əksəriyyətinin rəyinə görə təhrif baş vermişdir və bu, əl-Kuleyni'nin, onun şeyxi Əli ibn İbrahim əl-Qummi'nin və 'əl-İhticac' əsərinin müəllifi Şeyx Əhməd ibn Əbi Talib ət-Tabrasi'nin sözlərindən zahirən anlaşılan rəydir. Lakin əs-Seyyid (əl-Murtada), Şeyx əs-Səduq, əl-Muhaqqiq Təbrasi və müctəhidlərin əksəriyyəti isə təhrifin baş vermədiyini söyləmişlər."[1431] Belə bir təqdimatdan təhrif inancının həqiqətən də əxbarilər ilə üsulilər, yoxsa Kufə mədrəsəsi ilə digər mədrəsələr arasındakı bir ayırım olduğunu müəyyən etmək çətindir. Çünki ən-Nəraqi burada əs-Saduq'u müctəhidlər zümrəsinə aid etdiyi halda əxbarilər onu özlərindən biri kimi görürlər. Əslində əs-Saduq əxbarilərdən sayıla bilməz, lakin tam bir mənada müctəhidlərdən də sayılmaz. O, müctəhidlərə daha yaxın olan, lakin hədis təmayülü daha ağır basan xüsusi bir qrupa aid edilməlidir. Lakin bu danıla bilməz ki, mötəzililər ilə yaxınlaşmaq prosesində, onlarla dialoq məzmununda şiə alimlər üsul və ictihadı mənimsədikcə təhrif inancını tədricən tərk ediblər. əl-Mufid təhrif inancını qismən qəbul etdiyi halda əş-Şərif əl-Murtəda, Şeyxut-Taifə ət-Tusi bu etiqadı şiddətli şəkildə rədd edirlər və bunu şiə məzhəbindəki çirkin bir ləkə kimi görürlər. Əbul-Həsən əl-Əşari "Məqalət" kitabında şiələrdəki bu etiqadı müzakirə edərkən deyir ki, şiələrdən bir firqə Qurandan çox bir şeyin çıxarıldığını, lakin heç bir şeyin əlavə edilmədiyini, digər firqə isə əksinə Qurandan heç bir şeyin çıxarılmadığını, lakin ona əlavələr edildiyini iddia edir. "Onlardan üçüncü firqə isə - və onlar mötəzilə və imamət rəyində olanlardır - deyirlər ki, Qurandan heç bir şey çıxarılmayıb, ona heç bir şey artırılmayıb."[1432] Beləliklə də Kufə və Qumda təhrif inancının olması, lakin daha sonra Bağdad mədrəsəsinin, daha dəqiq desək üsuli məktəbinin güclənməsi və şiəlikdə ana çizgiyə çevrilməsi ilə bu inancın kənarlaşdırıldığını görürük. Çünki Kufə, Rəy, Qum şəhərlərindən olan məşhur şiə müəlliflərdə bu inancın olduğu bizə məlumdur. əl-Məclisi Quranın dəyişdirilməsi haqqında danışarkən Sad bin Abdilləh əl-Əşari'nin bu barədə "Ənva Ayət əl-Quran" adlı bir risalə yazdığını deyir.[1433] əl-Qummi təfsiri də özündə təhrif inancına dəlalət edən ən aşkar sübutları daşıyır. Kufəli Əli bin əl-Həsən bin Fəddal "ət-Tənzil minəl-Quran vat-Təhrif" adlı bir kitab yazıb[1434] və adından da anlaşıldığı

---

[1431] ər-Radavi, "İs'aful-Məmul bi Şərh Zubdətil-Usul", səh: 115;

[1432] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", səh: 47; Helmut Ritter təhqiqi

[1433] əl-Məclisi, "Bihər əl-Ənvar", 89/40

[1434] ət-Tehrani, "əz-Zəriah", 4/454;

kimi kitab Quranın təhrifi barəsindədir. Hicri üçüncü əsrdə yaşamış kufəli şiə alimi Əbul-Qasim Əli bin Əhməd əl-Kufi "əl-İstiğasə fi Bidəi əs-Sələsə" kitabında xəlifə Osmanın çıxardığı "bidətlər" haqqında danışarkən deyir: "O mushaflarda Qurandan elə şeylər var idi ki, Osman onları bəyənmədi və insanların əlindən alıb məhv etdi və bu, onun Allaha və elçisinə qarşı inadının sübutu olaraq kifayət etməlidir."[1435] əs-Seyyid Muhəmməd ət-Tənkəbəni yazır: "(Quranda) təhrifin – yəni qəsdən və ya səhvən və ya unutma nəticəsində, yaxud da … xəbərsiz olmaq nəticəsində baş verməsi arasında fərq olmadan daha geniş mənada naqislik səbəbi ilə dəyişikliyin - baş verib verməməsində ixtilaf ediblər. Üsuli alimlər arasında məşhur olan budur ki, təhrif mütləq şəkildə baş verməyib. əs-Saduq - "əl-İtiqadət" kitabında - və başqaları kimi mühəddislərdən bir qrup da bu rəyi mənimsəyiblər. Keçmiş mühəddislərdən bir qrup isə təhrif rəyini qəbul ediblər; əl-Kuleyni, onun şeyxi Əli ibn İbrahim əl-Qummi, ən-Nu'məni, Sa'd ibn Abdillah əl-Əş'ari, əl-Ayyəşi, Növbəxt ailəsi, Fadl ibn Şazan, Məhəmməd ibn Həsən əş-Şeybani, Əli ibn əl-Həsən ibn Faddal, Şəhidin şagirdi Şeyx Həsən ibn Süleyman əl-Hilli, Məhəmməd ibn Əli bin Şəhrəşub, Şeyx Əhməd ibn Əbi Talib ət-Tabrasi "əl-İhticac" kitabında, həmçinin Şeyx əl-Mufid "əl-Məsail əs-Səraviyyə" kitabında, Mövla Muhəmməd Saleh (əl-Məzəndərani) "əl-Kafi" kitabının şərhində, əl-Məclisi'lərin hər ikisi, əs-Seyyid Alixan "əs-Səhifə" şərhində və Mövla Mehdi ən-Nəraqi onlardan nəql olunanlara əsasən bu rəydə olanlar arasındadır. Eyni şəkildə, bu görüşə "əl-Mustənəd" kitabının müəllifi əl-Həcc Molla Əhməd ən-Nəraqi də ondan hekayət olunana görə bu rəyi götürüb. əs-Seyyid əl-Cəlil Əli ibn Tavusun "*Fəlahus-Sail*" və "*Sə'dus-Su'ud*" adlı əsərlərindəki sözlərinin zahiri də bu görüşü göstərir. Eləcə də, bu, müəllifin ("*əl-Urvə*" müəllifini nəzərdə tutur) "namazda qiraət" mövzusundakı sözlərinin zahiridir. Əxbarilərin əksəriyyəti bu görüşü qəbul ediblər. əl-Muhəqqiq əl-Bəhbəhani "əl-Fəvaid" kitabında əhkam ayələri müstəsna digər ayələrdən bəzi şeylərin çıxarılması formasında təhrifin baş verdiyini söyləyir. Bu, həmçinin "əl-Qavanin" kitabının sahibi əl-Muhəqqiq əl-Qummi'nin də görüşüdür…"[1436] Hüseyn Taqi ən-Nuri'yə inanmalı olsaq şiələrin arasında Quranın təhrifi etiqadını ilk dəfə inkar edən əs-Saduq olub.[1437] Səfəvilərin dönəmində dövlət dəstəyindən yararlanaraq intişar edən

---

[1435] Əbul-Qasim əl-Kufi, "əl-İstiğasə fi Bidəi əs-Sələsə", səh: 92;

[1436] ət-Tənkəbəni, "İydahul-Fəraid fi İlm əl-Usul", 1/202;

[1437] ən-Nuri, "Fəslul-Xitab", səh: 182-183; əl-İntişar əl-Arabi

əxbarilik hərəkatı, qədimdə mövcud olmuş və üsuli şiələr tərəfindən tərk olunmuş bu fikri təzədən canlandırmağı bacardı. Hətta məsələ o həddə çatdı ki, əxbari şeyxlərdən olan Abdullətif əl-Kəzərani yazır ki, “mənə görə, xəbərləri araşdırdıqdan və rəvayətləri təhlil etdikdən sonra bu rəyin doğruluğu aydın olur, beləki bu rəyin şiə məzhəbinin zərurətlərindən olmasına hökm etmək mümkündür. Demək olar ki, xilafəti qəsb etməyin gətirib çıxardığı ən böyük fəsadlardan biri də budur. Bunun haqqında düşün ki, əs-Saduq’un bu məqamda xəta etdiyini başa düşəsən…”[1438] əs-Saduq’un rəyi ilə qəsd etdiyi onun “əl-İtiqadət” kitabında şiələrə nisbət olunan Quranın təhrifi inancının yalan olduğunu deməsidir. əl-Kəzərani bu məsələdə əs-Saduq’un xəta etdiyini deyir. İnkar edilə bilməyəcək bir faktdır ki, günümüzdə Quranın təhrifi inancı xüsusilə əxbari dairələrdə dəstək görür, üsuli şiələri bu fikri rədd edirlər. Hətta əl-Mutahhəri qeyd edir ki, vaxtında əxbarilər öz versiyalarına uyğun olan ayrıca bir Quran çap etməyə səy göstəriblər. O bu barədə yazır: “Beləcə də onlar təhrif etmək və dəyişdirmək yolu ilə Quranı oyuncağa çevirdilər, elə ki, öz düşüncələrinə uyğun olan xüsusi bir Quran topladılar. Bir neçə il əvvəl onu çap etməyə qərar verdilər və hətta çap etməyə başladılar. O zaman mərhum Ayətullah əl-Uzma əs-Seyyid əl-Burucərdi bunun xəbərini öyrəndikdə dərhal onların çapını dayandırdı və həmin “quran” nüsxələrinin müsadirə edilib dənizə atılmasını əmr etdi.”[1439]

əl-Qazvini həmçinin qeyd edir ki, Əlini peyğəmbərlərdən üstün saymaq üsulilərin məzhəbindən deyildir. “Erkən şiələrdən bəzi əxbarilər və həşəvilər ola bilsin ki, Əlinin imamlıq məqamını əldə etməmiş peyğəmbərlərdən üstün olduğuna etiqad ediblər. Lakin bu etiqad məqbul deyildir, faydasızdır, mərduddur və dəlilsizdir.”[1440] Üstəlik qeyd edir ki, üsulilərə görə peyğəmbərin səhabələrinə qarşı düşmənçilik etmək, onlara nifrət etmək, söymək, təkfir etmək olmaz, səhabələr münafiq sayılmazlar, onlar da möminlərdirlər.[1441] əl-Qazvini’nin bunu üsuli şiələrə nisbət etməsindən anlaşılır ki, əks rəyi əxbarilərə aid edir. Qeyd etməyimiz lazımdır ki, Əlinin peyğəmbərlərdən üstünlüyü məsələsində, həm də səhabələri təkfir etmək, onları nifaqa nisbət etmək, onlardan bəraət etmək məsələsində əl-Qazvini xəta edir,

---

[1438] əl-Kəzərani, “Mirətul-Ənvar va Mişkətul-Əsrar”, səh: 84;

[1439] əl-Mutahhəri, “əl-İsləm va Mutətallibət əl-Asr”, səh: 89;

[1440] Robert Gleave, “Scriptualist Islam: The History and Doctrines of the Akhbari Shi’i School”, səh: 22; Brill, Leiden, 2007

[1441] Gerami, səh: 31-32;

əslində bu məsələlərdə üsulilər əl-Qazvini'nin təqdim etdiyi məzhəb üzərində deyillər. Bu müzakirədən anlaşılır ki, əl-Qazvini'nin bizim üçün çəkdiyi mənzərədə müasir əxbari-üsuli polemikasına bənzəyən məqamlar yer alır, lakin bu mənzərə dəqiq deyildir və həqiqəti haqqı ilə əks etdirmir. Üstəlik Şeyx əs-Saduq kimi birini müasir əxbarilər özlərindən biri hesab etdikləri halda əl-Qazvini onu üsulilər sırasına daxil edir.

Müasir dövrümüzdə canlanmış əxbarilik məktəbini - məşhur rəyə əsasən - Muhəmməd əl-Əmin əl-Əstrabadi başladıb. əl-Əstrabadi müasir əxbarilik cərəyanını canlandıran əsas şəxsiyyət olsa da əxbarilik tək onun adı ilə bağlı deyildir. Onunla təxminən eyni dövrü bölüşmüş Abdullah ət-Tustəri və Abdulaziz əl-Əxbəri də müstəqil şəkildə bu yeni cərəyanın canlanmasına əmək sərf ediblər. Bu ikisi arasında ət-Tustəri daha görkəmli və daha nüfuzlu biri idi; Abdullah ət-Tuni və Muhəmməd Taqi əl-Məclisi (v. 1070/1659) onun tələbələri olub. Əxbariliyin növbəti mərhələsini Muhəmməd Təqi əl-Məclisi, Şeyx Hüseyn bin Şihəbuddin əl-Amili (v. 1076/1665) kimi mühəddislər ilə yanaşı əl-Əstrabadi'nin tələbələrindən Zeynulabidin əl-Kəşəni, Hüseyn əz-Zahiri, Zeynuddin əl-Amili, Məcid əl-Bəhrani, Abdulhədi ət-Tustəri kimiləri davam etdiriblər. Bunlardan birincisi əxbariliyində o qədər də görkəmli olmasa da əl-Amili ondan fərqli olaraq əxbari fikirlərini yaymaqda xeyli çalışqan idii. Bu mərhələdən sonra əl-Feyd əl-Kəşəni (v. 1091/1679) seçilir. Eyni zamanda fəlsəfə ilə məşğul olması ilə tanınan əl-Kəşəni üsulilərə qarşı çox sərt idi, hətta Yusuf əl-Bəhrani'nin sözlərinə görə əl-Kəşəni'nin sözlərindən anlaşılır ki, o, üsulilərdən bir qrupu küfrdə ittiham edirdi.[1442] Bu yolu izləmiş daha bir əxbari alimi Muhəmməd bin əl-Həsən əl-Hurr əl-Amili (v.1104/1692) bütün fəaliyyəti boyunca əxbariliyi və əl-Əstrabadi'nin fikirlərini müdafiə etdi. Əxbarilərin tədricən artan nüfuzunun ən böyük əlaməti Şeyx Muhəmməd Baqir əl-Məclisi'nin (v. 1111/1699) şəxsində özünü göstərdi; beləki səfəvi dövlətindəki alimlər piramidasının başına keçən məhz əl-Məclisi oldu. Lakin əl-Məclisi də atası kimi əxbariliyində şiddətli deyildi, əl-Kəşəni kimi üsulilərə qarşı ədavət və nifrət izhar etmirdi. Fəaliyyətinin əsas hissəsi imami şiələrinin kitablarında keçən xəbərləri bir araya gətirmək və onları fars dilinə tərcümə etməkdən ibarət idi. əl-Məclisi'nin müasiri və tələbəsi olmuş Nemətullah əl-Cəzəiri də (v.1112/1701) şeyxi kimi üsulilərə qarşı mötədil idi. Əxbarilərin meydana çıxması ilə imami

[1442] Luluətul-Bəhreyn, səh: 116;

şiələrində xəbərlərə qarşı xüsusi qayğı ortaya çıxdı. Onların nəzərində etibarlı sayılan dörd hədis kitabına şərhlər və haşiyələr yazıldı, sələflərinə nisbət etdikləri bir çox hədis cüzləri ortaya çıxarıldı. Artıq hicri on ikinci, miladi təqvimlə on səkkizinci əsrdə əxbarilik düşüncəsi şiə hövzələrində yayılmışdı. Bu cərəyan, gücünün zirvəsinə mühəddis Yusuf əl-Bəhrani'nin (v. 1186/1772) zamanında çatdı. O, 1165-ci ildə Kərbəlaya daxil olduqda Nəcəf şəhəri elm tələbələri ilə qaynayırdı; hər iki mədrəsədən ora tələbələr axışırdı. Çox keçmir ki, əl-Bəhrani şəhərin əsas məscidində imam və müdərris olur. Məhz bu ərəfədə üsuli mədrəsəsinin lideri əl-Vahid əl-Bəhbəhəni də (v. 1206/1791) Kərbəlada yerləşir və əxbari dəvətinə qarşı ciddi bir fəaliyyət göstərir. Maraqlıdır ki, əl-Bəhbəhəni'nin uğurlu şəkildə əxbariliyə qarşı təbliğat aparmasına imkan verən amillərdən biri də məhz Yusuf əl-Bəhrani'nin mötədil yanaşması və güzəşt etməsi olub. əl-Bəhbəhəni'nin fəaliyyətinə başladığı bir mühitdə əxbari hövzələrdə üsulilərin kitablarının oxunulması haram hesab edilirdi.[1443] İlk əvvəl gizlində dərslər verən əl-Bəhbəhəni qısa bir müddət sonra aşkardan əxbarilərə meydan oxuyur və əl-Bəhrani ilə ixtilaflı məsələlərdə münazirələr aparır. əl-Bəhrani'nin mötədilliyi özünü onda göstərirdi ki, o, tələbələrinə əl-Bəhbəhəni'nin arxasında namaz qılmağa izn verirdi, amma əl-Bəhbəhəni əksinə fətva vermirdi. Yusuf əl-Bəhrani ömrünün sonlarında əxbarilik xəttini tərk edərək orta bir mövqe tutmuş, beləliklə də nə tam mənada əxbari, nə də tam mənada üsuli olmuşdur.

Əxbarilərin içində ən radikal mövqeni təmsil edənlərin başında gələn Mirzə Muhəmməd əl-Bəhrani əl-Əxbari (1178-1235) olub. O, üsulilərə o dərəcədə nifrət edirdi ki, siyasi dairələri onların kökünü kəsməyə çağırırdı. Xəbərlərə inanmalı olsaq sözü gedən bu əxbari alimi Fəthəli Şahla əhd bağlamağa çalışır ki, İranın sərhədlərinə hücumlar təşkil edən rus generalı Sisyanov'un başı ona gətirildiyi təqdirdə o, əxbariliyi rəsmi məzhəb edəcək və üsuli məktəbini qadağan edərək onların sonuna çıxacaq. Lakin şah məsləhətə qulaq asaraq bu tələblərə əməl etmir.[1444] Onun qarşısında üsulilər tərəfindən Kəşiful-Ğita ləqəbli Cəfər bin Xidir ən-Nəcəfi (1156-1228) durdu və o, dediyimiz kimi əl-Vahid əl-Bəhbəhəni'nin tələbələrindən idi. O, "Kəşiful-Ğita an Məayib əl-Mirzə Muhəmməd Aduvvil-Uləmə" adlı kitabını məhz Mirzə əl-Əxbari'yə qarşı yazıb. Mirzə isə öz növbəsində ona "əs-Sayhətu bil-Haqq alə mən Əlhədə va Təzəndəqa" kitabı ilə cavab verib. Kitabın

[1443] ət-Tənkəbəni, "Qisas əl-Uləmə", səh: 157-158;

[1444] Edward G. Browne, "A Literary History of Persia", 4/374-375; Cambridge, 1959

adından aradakı hiddəti və şiddəti hiss etmək mümkündür, çünki üsulilərin şeyxini "mülhid" və "zındıq" adlandırması kifayət qədər ciddi ittihamların olduğundan xəbər verir. Hətta Kəşiful-Ğita vəfat etdikdə Mirzə onun haqqında - "donuz donuz xəstəliyindən öldü" - demişdir.[1445] Mirzə Muhəmməd əl-Əxbari deyilənə görə öz dilinin və qələminin qurbanı olub, alimlərə o qədər tənə edib ki, sonunda qəzəbli insanlar tərəfindən hücuma məruz qalır və Kazimiyyə'dəki mədrəsəsində qətl edilir.[1446] Əxbarilik bizim zamanımıza qədər qalsa da onların fəaliyyət mərkəzləri xeyli məhdudlaşıb. Bəhreyndə yerləşən Al Usfur mədrəsəsi bəlkə də əxbariliyin zamanımızdakı ən tanınmış mərkəzlərindəndir. İranda 1979-cu ildə baş vermiş inqilab ilə siyasi hakimiyyət əldə edən üsulilərin fəaliyyəti qarşısında əxbarilik geri çəkilməyə məcbur edilib.[1447]

## İmamət Nəzəriyyəsinin Təkamülü

Bura qədər təqdim etdiyimiz məlumatlardan aşkar şəkildə aydın olur ki, imami məzhəbi tarixin axarı boyunca müxtəlif təsirlərin altında dəyişib və fərqli mərhələlərdən keçib. Biz şiə etiqadının təkamülünü, tədrici dəyişikliklərini göstərmək üçün bəzi mərhələləri işıqlandıracağıq. Lakin bunun üçün ən qədim dönəmdən başlamayacağıq. Müasir imamiyyə şiəliyinin formalaşmasında müstəsna rolu olan, hicri dördüncü əsrin sonları və beşinci əsrin əvvəlində fəaliyyət göstərmiş şiə alimi Şeyx əl-Mufid'in dövrü ilə başlayaraq geriyə doğru gedəcəyik. Bilmək lazımdır ki, Şeyx Mufidin zamanında şiə alimləri arasında imamlarla bağlı inanclarda şiddətli ixtilaflar və məzhəblər olub. Şeyx Mufid kitablarının birində yazır: "Qum şəhərindən bizim yanımıza gəlmiş bir qrup gördüm ki, dində açıq-aşkar qüsur göstərirdilər; imamları – aleyhimussəlәm – öz mərtəbələrindən aşağıya qoyurlar və iddia edirlər ki, onlar qəlblərinə ilham gəlməyincə dini əhkamlardan xeyli bir şeyi bilmirdilər. Onların şəriət hökmündə rəyə və zənnə dayandıqlarını deyənlər gördüm,

[1445] ət-Taliqani, "əş-Şeyxiyyə", səh: 13;

[1446] əs-Subhəni, "Tərixul-Fiqh əl-İsləmi va Ədvaruhu", səh: 405;

[1447] Əhməd Quşti, "əs-Sira beynəl-Əxbəriyyin val-Usuliyyin", səh: 8-9;

bununla belə alimlər olduqlarını deyirlər."[1448] Buna misal olaraq eyni səhifədə Qum şəhərindən olan şiə alimi İbnul-Valid əl-Qummi'ni misal gətirir: "Əbu Cəfər Muhəmməd bin əl-Həsən bin əl-Valid'dən – rahiməhullah – zahir olan bir hekayə eşitmişik ki, oradakı təqsiri heç cür müdafiə edə bilmirik və ondan hekayət olunan bu (qüsur) onun belə deməsidir: "Aşırılığın ilk dərəcəsi peyğəmbərdən və imamdan səhvi inkar etməkdir." Əgər bu hekayə ondan səhihdirsə o, muqəssirdir, halbuki o, qummilərin alimlərindən və şeyxlərindəndir." Bu onu göstərir ki, o dövrün qumlu şiə alimləri bu günün qumlularını görsəydilər onları aşırılıqda, fanatizmdə ittiham edərdilər. Mufid'in sözlərindən həmçinin anlaşılır ki, Qum şəhərindən gəlmiş həmin şiələr siravi insanlar deyildilər, şiələrin alimləri idilər. İbnul-Valid'in tələbələrindən olan digər məşhur şiə alimi, Şeyx əs-Saduq adı ilə tanınmış İbn Bəbəveyh əl-Qummi yazır: "Aşırılar və mufəvvida[1449] – Allah onlara lənət etsin! – peyğəmbərin səhv edə biləcəyini inkar edirlər..."[1450] Diqqət et ki, peyğəmbərin – aleyhissalətu vassələm – səhv etmək vəsfini inkar etməyi necə bidət firqələrinə nisbət etdi! Əgər tamamilə səhvsiz məsumluq məsələsində imamiyyə şiələrində mötəbər bir ixtilaf olsaydı İbn Bəbəveyh bunu bu şəkildə təqdim etməzdi. Bu zamanda şiələrin arasında etiqad sahəsində ixtilafların olunması inkar olunmaz bir faktdır. Bir başqa şiə alimi əl-Vahid əl-Bəhbəhəni deyir: "Bil ki, aşkar olan budur ki, qədim alimlərin böyük bir hissəsi – onların arasından xüsusilə qummilər və əl-Ğadairi – ictihadları və rəylərinə uyğun olaraq imamlar haqqında ucalıq, yüksək status baxımından xüsusi bir mərtəbəyə, məsumluq və kamillik baxımından müəyyən bir mərtəbəyə etiqad edirdilər və bu həddi aşmağı icazəli görmürdülər. Öz etiqadları əsasında bu həddi aşmağı aşırılıq, radikallıq hesab edərdilər, hətta onların səhv edə biləcəklərini inkar etməyi də aşırılıq hesab edərdilər... hətta onların möcüzələrində mübaliğə etməyi, onlardan qeyri-adi xariquladələr nəql etməyi və ya onların şanını çox-çox ucaltmağı, onları bir çox nöqsandan tənzih etməyi, onların güclü qüdrət sahibi olduqlarını izhar etməyi, Göydə və Yerdə olan gizli şeylər barəsində elmlərinin olduğunu deməyi aşırılıq sayardılar, ittiham olunmaq üçün səbəb hesab edərdilər..." Sonra əl-Bəhbəhəni önəmli bir qeydə yer verir: "Xülasə görünən budur ki, qədim alimlər həmçinin

---

1448 əl-Mufid, "Təshih İtiqadət əl-İməmiyyə", səh: 135-136; Darul-Mufid, 1414

1449 əl-Mufəvvida; aşırı şiə firqələrindən biridir və onlar təxminən Cəfər əs-Sadiq'in zamanında ortaya çıxıblar. Onların inancına görə imamlar Allahın xüsusi yaratdıqlarıdır və Allah daha sonra yaratmaq, ruzi vermək kimi ilahi sifətləri onlara vermişdir.

1450 əs-Saduq, "Mən Lə Yəhduruhu əl-Fəqih", 1/249; Muəssəsətul-Alə lil-Mətbuat, 1406

usul məsələlərində də ixtilaf halında idilər; ola bilsin ki, bir şey onlardan bəzilərinə görə fasid və ya küfr və ya aşırılıq və ya "təfvid" və ya "cəbr" və ya "təşbih" olsun, başqasına görə isə ona etiqad etmək vacib olsun…"[1451] Eyni həqiqəti bir başqa şiə alimi Abdullah əl-Məməqani bu sözləri ilə ifadə edir: "Güclü tədqiqatçı alim görəcək ki, (İbn əl-Ğadairi və Qum şəhərindən olan alimlər tərəfindən) aşırılıqda ittiham edilən (ravi)lərin əksəriyyəti həqiqətdə aşırılıqdan uzaqdır və imamların – aleyhimussələm – vəsfləri ilə bağlı bu gün məzhəbin zərurətlərindən sayılan şeylərin çoxu qədim zamanlarda aşırılıq hesab olunurdu…"[1452] Beləliklə də, ey insaf sahibi şiə qardaşım, öyrənmiş oldun ki, bu gün şiə məzhəbi olaraq öyrədilən bir çox etiqad əsasları zamanında aşırılıq, radikallıq hesab olunurdu, hətta fasid və küfr hesab olunub. İsmət inancı da məhz bu dövrdə məzhəbin ayrılmaz bir hissəsinə çevrilib, üsul və qayda halına gətirilib. Muhəmməd Asif Muhsini bu həqiqəti bu sözləri ilə ifadə edir: "Sonra əs-Saduq, əl-Murtəda və ət-Tusi gəldilər və imamın məsum olmasına dair üsuli dəlillər zikr etdilər. Beləliklə də (məsumluq) şiələrin arasında məşhurlaşdı. Onlardan sonra digər alimlər gəldilər, bunu təkidlə təsdiqlədilər; onlardan biri də müəllif əl-Alləmə (əl-Məclisi) olub və onun sözünün nüfuzu var idi, buna görə də (məsumluq etiqadı) müsəlləm məsələlərdən birinə çevrildi."[1453] Bu sözlərdən çıxan məntiqi nəticə budur ki, əs-Saduq, əl-Mufid, əl-Murtəda və ət-Tusi kimi alimlərdən əvvəl şiələr arasında məsumluq inancı məşhur deyildi. O dövrün imami şiələrində imamların məsumluğuna inanmaq məzhəbin zəruri olaraq bilinən məsələlərindən deyildi. Bu dönəmin ən tanınmış şiə fəqihlərinin imamlar barəsindəki inanclarına nəzər salsaq görərik ki, onlar imamların şəriət məsələlərində verdikləri fətvaları məsumluqdan qaynaqlanan sözlər olaraq görmürdülər. Böyük qeybət dönəmi başladıqdan sonra şiələrdə böyük alim və fəqih kimi etibar qazanmış İbn əl-Cuneyd əl-İskəfi kimi bir şəxsiyyət inanırdı ki, imamlardan gəlmiş rəvayətlər arasındakı ixtilaf və ziddiyyətlər onların ictihadlarında ixtilaf etməklərindən qaynaqlanırdı. O, Misir əhlinin suallarına cavab olaraq yazdığı "əl-Məsəil əl-Misriyyə" kitabında imamların sözlərinin öz şəxsi ictihadlarına və rəylərinə əsasən dediklərini göstərməyə çalışırdı.[1454] əl-Mufid təsdiq edir ki, İbnul-

---

[1451] əl-Əstrəbəzi, "Minhəc əl-Məqal ti Təhqiq Əhval ər-Ricəl", 1/128-129; Muəssəsətu Al Beyt, 1422

[1452] əl-Məməqani, "əl-Fəvaid ər-Ricəliyyə min Tənqih əl-Məqal", 2/305; Muəssəsətu Al Beyt, 1431

[1453] Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 1/451;

[1454] əl-Mufid, "əl-Məsəil əs-Səraviyyə", səh: 75;

Cuneyd'ə görə imamlar ictihadlarına əsasən fətva veriblər və bir imamın ictihadı digərindən fərqli olub. Bu isə o deməkdir ki, imamların digər müctəhidlər kimi öz fətvalarında xəta edə bilməsi İbnul-Cuneyd'in nəzərində mümkün idi. İbnul-Cuneyd isə şiə məzhəbində sıradan bir alim kimi tanınmayıb. Bəhrul-Ulum ət-Tabətabəi onun haqqında yazarkən deyir: "(Şiə) tayfa(sı)nın böyüklərindən, firqənin əzəmətlilərindən, imami məzhəbinin qədim alimləri arasında ən fəzilətlilərindən, elmi, fiqhi və ədəbi ən çox olanlardan, ən çox kitab yazanlardan və məsələləri ən gözəl şəkildə təhrir edənlərdən, nəzəri düşüncəsində ən dəqiq olanlardandır…"[1455] Abbas əl-Qummi də onu "şiə alimlərinin ən böyüklərindən" olmaqla tanıdır.[1456] Kəməl əl-Heydəri onun haqqındakı bu şahidliklərdən çıxış edərək qeyd edir ki, İbnul-Cuneyd şiə alimləri tərəfindən zülmə məruz qalmış bir alim olub. Bunun əsas səbəbi onun qiyasa əsaslanması və bunu imamların məzhəbi olaraq görməsi olub. Şeyxut-Taifə ət-Tusi yazır ki, "gözəl kitablar yazan biri idi, lakin qiyas rəyində olduğu üçün onun kitabları tərk olundu və ona əsaslanmadılar."[1457] ən-Nəcəşi də yazır: "Etibarlı şeyxlərimizdən belə dediklərini eşitdim ki, o, qiyas rəyində idi."[1458] Bəhrul-Ulum ət-Tabətabəi kitabında İbnul-Cuneyd'i müzakirə edərkən əl-Mufid'in sözlərinə toxunur və deyir: "Burada belə bir sual vermək yerinə düşür: Qiyası qadağan etmək imamiyyə məzhəbinin zərurətlərindəndir, bu barədə imamlardan gəlmiş rəvayətlər mütəvatirdir, beləliklə də bu məsələdə müxalif olan kəs məzhəbdən çıxmış olmalıdır, onun rəyi etibara alınmamalıdır, hətta belə birini siqa saymaq da olmaz… Bundan da daha ağırı əl-Mufid'in ondan nəql etdiyidir ki, o, rəyə əsasən fətva verməyi imamlara nisbət edib. Bu isə çox pis bir rəydir, çirkin bir sözdür; belə bir söz imamların məsum olmaqları, onların xəta etməklərinin mümkün olmaması fikri ilə necə bir arada mümkün ola bilər?!… Görünür ki, bu möhtərəm şeyxin bu məsələdə ayağı axıb və imamlardan gələn xəbərlərin arasındakı ixtilaf onun bu cür çirkin rəyi mənimsəməsinə səbəb olub." Daha sonra Bəhrul-Ulum əlavə edir: "(Onun) bu (rəydə olması i)lə alimlərimizin onun böyüklüyü, onun sevilməsi üzərində ittifaq etməklərini bir araya gətirməyin yolu, o dövrdə belə bir şübhənin ola bilməsi ilə izah etməkdir, çünki o dövrdə bu məsələ zərurət həddinə çatmamışdı.

---

[1455] Bəhrul-Ulum, "əl-Fəvaid ər-Ricəliyyə", 3/205-206;

[1456] Abbas əl-Qummi, "əl-Kunə val-Əlqab", 2/26;

[1457] ət-Tusi, "əl-Fihrist", səh: 209 (rəq: 601)

[1458] "Ricəl ən-Nəcəşi", səh: 388;

Beləki məsələlər müxtəlif zamanlar ərzində aydınlıq və gizlilik baxımından fərqlənə bilər…"[1459] Qiyasa əsasən hökm verməyə gəldikdə görünən budur ki, keçmişdə şiə alimləri arasında qiyasa əsaslanaraq fətva verənlər olub. əş-Şərif əl-Murtəda yazır: "Ravilərimiz və hədislərimizi nəql edənlər arasında qiyas rəyində olanlar, şəriətdə ona əsaslananlar olub. əl-Fədl bin Şazan, Yunus və tanınmış bir qrup alim bunun misalıdır. Şübhəsiz ki, şəriətdə qiyasa əsaslanmağın doğru olduğuna inanmaq küfrdür…"[1460] Bəhrul-Ulum da həmçinin İbnul-Cuneyd kimi qiyas rəyində olanların arasında əl-Fədl bin Şazan'ı və Yunus bin Abdirrahmən'in adını çəkir, bu rəyin başqalarına da aid olduğunu deyir. Bu qiyasla bağlı olan hissədir, imamlara rəy və ictihad nisbət etməyə gəldikdə Bəhrul-Ulum yazır: "İmamlara - aleyhimussələm - rəy nisbət etməyə gəldikdə isə belə bir şeyin o əsrdə belə olması mümkündür."[1461] Burada qəsd etdiyi məna budur ki, İbnul-Cuneyd'in zamanında imamlar barəsində belə bir şeyə etiqad etmək mümkün idi, çünki məsələ hələ məzhəbin zərurətlərindən birinə çevrilməmişdi. Biz əlavə etməliyik ki, bu barədə fikir ayrılığı İbnul-Cuneyd'dən də qədimdir. İmam Əli ər-Rida vəfat etdikdə oğlu Muhəmmədin sadəcə yeddi yaşı var idi; belə bir reallıq şiələrin arasında parçalanmağa səbəb olmuşdu. Onların içində bir qrup inanırdı ki, imam üçün şəriətin hökmünü bilmək üçün qiyasdan istifadə etmək icazəli idi. əl-Əşari əl-Qummi deyir ki, "bu firqənin bir hissəsi hökmlərdə onun qiyas edə biləcəyini icazəli görürdülər və iddia edirdilər ki, qiyas elçilər, peyğəmbərlər və imamlar üçün icazəli idi."[1462]

Zaman kəsimində bir qədər də geriyə getsək bu dediklərimizin təsdiqini tapacağıq. Bu zamana qayıtdığımızda görürük ki, bu inanclar şiələr arasında o qədər də aydın olan bir məsələ deyildi, əksinə şiələrin böyük bir qisminə görə imamlar haqqında bu inanca sahib olmaq bir kimsənin şiəliyini müəyyən etmir. İmamların öz dövründə yaşamış və onlardan hədislər rəvayət etmiş şiələrin ciddi bir hissəsi ümumiyyətlə imamların məsum olduqlarına inanmırdılar, sadəcə olaraq onların saleh alimlər olduqlarına etiqad edirdilər. Bu həqiqəti bizə şiələrdə əş-Şəhid əs-Səni ləqəbi ilə tanınmış Zeynuddin bin Əli bin Əhməd əl-Amili (911-965) "Həqaiqul-İmən" kitabında etiraf edir və yazır: "İmanın təhaqquq etməsi üçün (bu təfsilat) etibara alınırmı yoxsa onların imamlığına və

---

[1459] Bəhrul-Ulum, "əl-Fəvaid ər-Ricəliyyə", 3/214-219;

[1460] əş-Şərif əl-Murtəda, "Rasəil əş-Şərif əl-Murtəda", 3/311;

[1461] Bəhrul-Ulum, "əl-Fəvaid ər-Ricəliyyə", 3/219;

[1462] əl-Əşari əl-Qummi, "Kitəb əl-Məqalət val-Firaq", səh: 98; Mətbəətu Heydəri, Tehran

itaətlərinin vacibliyinə icmali olaraq etiqad etmək kifayət edir? Bu barədə ... iki rəy vardır; bunlardan birincisini tərcih etmək mümkündür... ikinci rəylə də kifayətlənmək uzaq (ehtimal) deyildir, çünki imamların şiələri arasından onlardan rəvayət edənlərin və onların müasirlərinin əksəriyyətinin zahirən halı belə idi; hətta onlardan çox hissəsi imamların məsumluğuna etiqad etmirdilər, çünki onlara gizli qalmışdı. Əksinə onların saleh alimlər olduqlarına inanırdılar. Bu kəslərin həyatlarını və hədislərini incələmiş kəs bunu bilir. Əbu Amr əl-Kəşşi'nin kitabında bunu göstərəcək bir xeyli məlumat vardır..."[1463] Biz həqiqətən də bu cür rəvayətlər ilə şiə qaynaqlarında tez-tez rastlaşırıq. Misal üçün əl-Kəşşi "ricəl" kitabında isnadını qeyd edərək yazır ki, Əbul-Abbas əl-Bəqbəq dedi: "İbn Əbi Ya'fur və Muallə bin Xuneys müzakirə etdilər və İbn Əbi Yafur dedi: "Vasilər saleh və təqvalı alimlərdir." İbn Xuneys isə dedi: "Vasilər peyğəmbərlərdir." Sonra hər ikisi də Əbu Abdilləh'in – aleyhissələm – yanına daxil oldular və onun yanına oturduqlarında Əbu Abdilləh dedi: "Ey Abdullah, bizim peyğəmbərlər olduğumuzu deyəndən bəriyəm."[1464] Rəvayət şiə alimi əl-Xoyi'yə görə səhihdir.[1465] Diqqət edək ki, İbn Əbi Yafur ilə Muallə bin Xuneys arasında gedən bu müzakirə şiələrdə bu gün "zəruri" olaraq bilinən məsələlərdən biri ilə bağlıdır. İbn Əbi Yafur şiələrin imamlarını sadəcə olaraq "saleh və təqvalı alimlər" olaraq görməklə müasir şiə təsəvvüründən tamamilə uzaqlaşır. Onu da qeyd edək ki, İbn Əbi Yafur şiələrdə adi bir şəxsiyyət deyildir; Şeyx əl-Mufid'ə görə o, "halal və haramın, fətva va əhkamın ondan öyrənildiyi böyük fəqihlərdən və başbilənlərdəndir..."[1466] Necə olur ki, İmam Əbu Abdulləh əs-Sadiqin müasiri və onu sevənlərdən biri, xüsusilə də şiələrdə alim və fəqih olaraq tanınan bir zat imamların məsum, ləduni elmə malik, bənu-israil peyğəmbərlərindən də əfzəl olduqlarını bilmirdi?! Həmçinin əl-Kəşşi rəvayət edir ki, "Əbul-Abbas Fədl əl-Bəqbəq (İmam) Əbu Abdilləh'dən Hariz'in onun yanına daxil olması üçün izn istədi, o icazə vermədi. Yenidən soruşdu, amma yenə də icazə vermədi. Sonra soruşdu: "Bir şəxs öz qulluqçusunu hansı həddə qədər cəzalandıra bilər?" O cavab verdi: "Günahlarının miqdarına görə." Sonra dedi: "Allaha and olsun ki, sən Harizi etdiyindən daha artıq cəzalandırmısan." (İmam) Əbu Abdullah dedi: "Vay sənin halına! Hariz qılıncını çəkdiyi üçün bunu

---

[1463] əş-Şəhid əs-Səni, "Həqaiqul-İmən", səh: 150-151; Mətbəə Seyyid əş-Şuhədə, 1409

[1464] əl-Kəşşi, "Ricəl-Kəşşi", səh: 180; Muəssəsətul-Alə lil-Mətbuat, 1430

[1465] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 19/267; Muəssəsə əl-İməm əl-Xuyi əl-İsləmiyyə

[1466] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 11/103; Muəssəsə əl-İməm əl-Xuyi əl-İsləmiyyə

etmişəm.” Daha sonra əlavə etdi: “Əgər sənin yerinə Huzayfə ibn Mənsur olsaydı, mən "yox" dedikdən sonra bir daha israr etməzdi.”[1467] Rəvayətlərə görə Hariz qılınc çəkərək Sicistanda xavariclərə qarşı vuruşmuşdu. Onun bu hərəkətini təqdir etməyən İmam əs-Sadiq onu buna görə cəzalandırmış, özündən kənarlaşdırmışdı. Bu rəvayətdə əl-Bəqbəq onun adından icazə istəyir. Lakin gördüyümüz kimi İmam əs-Sadiq icazə vermədiyi üçün əl-Bəqbəq onu ədalətsizlikdə ittiham edir. Şiələrdə Bəhrul-Ulum ləqəbi ilə tanınan Muhəmməd Mehdi ət-Tabətabayi bu xəbərin səhih olduğunu yazdıqdan sonra deyir: “Bu xəbərdə əl-Bəqbəq’dən İmama - aleyhissələm - qarşı böyük bir cürət göstərdiyi keçir, beləki İmama onun məsumluğu ilə düz gəlməyən bir şeyi nisbət edir. Bu və buna bənzər xəbərlərə əsasən deyilib ki, sələfin zamanında İmamın - aleyhissələm - məsumluğu zəruri etiqad deyildi.”[1468] Bəhrul-Ulum bunun doğru olmadığını deyir, yəni ona görə məsələ zəruri idi. Lakin kitabından bir az sonra əş-Şəhid əs-Səni’nin bu etirafını ələ aldıqda qəbul etməli olur ki, o dövrdə məsumluq etiqadının zərurət olmaması mümkündür. O əş-Şəhid əs-Səni’nin bu sözləri haqqında yazır ki, “...bunu, bunun mümkün olduğu həmin əsrlərə aid etmək vacibdir, ondan sonrakı zamanlara aid etmək olmaz, çünki ondan sonrakı zamanlarda məsələ qəti olaraq zərurət həddinə çatdı.”[1469] Yəni bundan əvvəl zəruri məsələlərdən deyildi, yalnız sonralar zəruriləşdi. əl-Kəşşi kitabında isnadı ilə rəvayət edir ki, İsa bin Əbi Mənsur, Əbu Usamə əş-Şəhhəm və Yaqub əl-Əhmər dedilər: “Əbu Abdilləhin - aleyhissələm - yanında oturmuşduq. Zurara onun yanına daxil oldu və dedi: “əl-Həkəm bin Uteybə sənin atandan belə dediyini rəvayət edib: “Məğrib namazını Muzdəlifə’yə çatmadan qıl!” Əbu Abdilləh ona dedi: “Mən bunu diqqətlə düşündüm, atam heç zaman belə bir söz deməyib, əl-Həkəm atamın adından yalan danışıb.” Zurara onun yanından belə deyərək çıxdı: “əl-Həkəm’in onun atasının adından yalan danışdığını düşünmürəm.”[1470] Bir imamın məsum olduğuna inanan kəs heç zaman ona bu şəkildə etiraz etməz. İmam Cəfər əs-Sadiq’in əshabından olan Şihəb bin Abdi Rabbih’in əhvalatı da maraqlıdır. əl-Kuleyni’nin rəvayət etdiyi bir xəbərdə əl-Valid ibn Sabih nəql edir: Şihab ibn Əbdi Rabbih mənə dedi: “Əbu Abdullah’a -

---

[1467] ət-Tusi, “İxtiyər Mərifətir-Ricəl”, 1/383;

[1468] Bəhrul-Ulum, “Ricəl əs-Seyyid Bəhr əl-Ulum”, 3/188; Məktəbətus-Sadiq, 1404

[1469] Bəhrul-Ulum, “Ricəl əs-Seyyid Bəhr əl-Ulum”, 3/220; Məktəbətus-Sadiq, 1404

[1470] ət-Tusi, “İxtiyər Mərifətir-Ricəl”, 1/414 (264); Bu rəvayətin isnadındakı ravilər şiə ricəl alimlərinə görə siqadır.

əleyhissəlam - məndən salam çatdır və ona bildir ki, yuxuda tez-tez məni vahimə basır." Mən də ona dedim: "Şihab sənə salam göndərir və deyir ki, yuxuda məni vahimə bürüyür." Belə buyurdu: "Ona de ki, malının zəkatını versin." Mən bunu Şihaba çatdırdım. O dedi: "Cavabımı ona çatdıra bilərsən?" Dedim: "Bəli." Dedi: "Ona de ki, uşaqlar belə — hələ böyük kişiləri demirəm — bilirlər ki, mən malımın zəkatını verirəm." Mən bunu ona çatdırdım. O buyurdu: "Ona de: sən zəkatı verirsən, amma onu layiq olduğu yerlərə sərf etmirsən."[1471] Şihabın bu şəkildə etiraz etməsi onu göstərir ki, o, imamın ən bəsit məsələlərdə belə xəta edə biləcəyinə inanırdı, əks təqdirdə ondan gələn cavaba bu şəkildə cavab verməsinin heç bir mənası yoxdur. Bir başqa rəvayətdə **Şueyb əl-Aqraqufi deyir:** Əbu'l-Həsənə – aleyhissəlam – əri olan qadınla evlənmiş, lakin ərinin olduğundan xəbəri olmamış bir kişi barədə sual verdim. (İmam) buyurdu: "Qadın rəcm edilir, lakin kişi bilməmişdirsə, ona bir cəza düşmür." Bu barədə Əbu Bəsirə danışdım. O dedi: "Allaha and olsun ki, Cəfər – aleyhissəlam – belə demişdi: "Qadın daşqalaq edilir, kişi isə zina cəzası olaraq şallaqlanır." Sonra əli ilə sinəmə toxunaraq onu qaşıdı və dedi: "Zənn edirəm ki, bizim sahibimiz (yəni İmam Əbu'l-Həsən) hələ elmdə kamilləşməyib."[1472] Bununla İmam Musa əl-Kazım'ın elminin hələ də kamilləşmədiyini, verdiyi fətvalarda xəta etdiyini qəsd edir. Rəvayətin muvassəq olduğunu deyən Muhəmməd Təqi əl-Məclisi deyir: "Zahir olan budur ki, bu kor, əs-Sadiq'in sözünü başa düşməyib və iştibaha düşüb."[1473]

Biz bu dövrdə çox önəmli olan daha bir məsələyə baxsaq görəcəyik ki, məsələ orada da ürəkaçıcı deyildir, əksinə daha da qarışıq, daha azdırıcıdır. Ümumiyyətlə şiəliyin ortaya çıxdığı dövrdən sonuncu imama qədər şiələrdə imamlıq haqqında aydın bir təsəvvür olmayıb. Bunun ən bariz misalı şiəlikdə yaranmış firqələrin çoxluğunda, öz aralarındakı şiddətli ixtilaflarda görə bilirik. Bunun üçün imami şiəsi Həsən bin Musa ən-Nubəxti'nin bu barədə yazdığı kitabından misallar gətirəcəyik. Bil ki, ey şiə qardaşın, Əlinin – radiyallahu anhu – vəfatından sonra imamların kimliyi ilə bağlı ortaya çıxmış ilk firqə "Keysənilər" olub: "Bir firqə isə (Əlidən sonra) Muhəmməd bin əl-

---

[1471] əl-Kuleyni, "əl-Kəfi", 3/546; əl-Məclisi "Miratul-Uqul" kitabında (16/82) həsən olduğunu yazır.

[1472] ət-Tusi, "Təhzibul-Əhkəm", 7/487;

[1473] əl-Məclisi, "Ravdatul-Muttəqin", 16/172 (Dar əl-Kitəb əl-İsləmi); Belə görünür ki, əl-Məclisi buradakı Əbu Bəsir'in əl-Əsədi olduğuna inanır, çünki kor olan Əbu Bəsir əl-Əsədi idi. Amma əl-Kəşşi'nin rəvayətində onun əl-Muradi olduğu keçməkdədir.

Hənəfiyyə'nin imam olduğunu dedi; çünki Basra günündə onun atasının sancağını iki qardaşı yox, məhz o, daşıyırdı..."[1474] Beləliklə də başa düşürük ki, Muhəmməd bin əl-Hənəfiyyə'ni imam hesab edən şiələrdə imamlıq haqqında aşkar dəlillər yox idi. ən-Nubəxti həmçinin xəbər verir ki, əl-Həsən bin Əli'nin imamlığını qəbul edən şiələrin bir hissəsi daha sonra ondan üz döndərib şiəliyi ümumiyyətlə tərk edirlər, bunun səbəbi isə Həsənin Müaviyə ilə sülh bağlaması və Müaviyənin ona göndərdiyi hədiyyələri qəbul etməsi olmuşdu. Hüseyn şəhid edildikdə hər iki qardaşın imamlığını qəbul edən şiələrin bir hissəsi yenə şiəliyi tərk edirlər, çünki onlara görə Həsənin yanında ordu və güc olduğu halda Müaviyə ilə sülh bağladısa, Hüseynin yanında isə güc olmadığı halda Yezidə qarşı üsyan edib şəhid edildisə bunların ikisi də haqq ola bilməz; beləliklə də bir qrup bu səbəbə görə şiəliyi tərk etdilər. Geridə qalan şiələr isə bir çox firqəyə bölündülər; bir firqə dedi ki, əl-Həsən və əl-Hüseyn'dən sonra İmam Əliyə ən yaxın olan Muhəmməd bin əl-Hənəfiyyə olduğu üçün imam məhz odur. İkinci bir firqə isə əl-Həsən və əl-Hüseyni imam olaraq qəbul etmədilər, yalnız Muhəmməd bin əl-Hənəfiyyə'nin imam olduğunu, onun Əlinin vasisi olduğunu və Mehdi olduğunu dedilər. Bunlar dediyimiz kimi "keysanilər" adlandı. ən-Nubəxti daha sonra Muhəmməd bin əl-Hənəfiyyə'nin ölümündən sonra onu imam hesab edən şiələrin öz aralarında çox sayda firqələrə ayrıldığını yazır və hər biri haqqında məlumat verir. "Ələvi" şiələri adlandırdığı qruplara gəldikdə isə onlar Hüseyn'in şəhadətindən sonra bir neçə qola ayrıldılar; bir qrup dedi ki, Hüseyndən sonra imam yoxdur və iddia etdilər ki, imamların hamısı üçdür və adlarını peyğəmbər – aleyhissalətu vassələm – xəbər vermişdi. Digər firqə isə Hüseyn'in oğlu Əli Zeynulabidin'in imam olduğunu dedi. Üçüncü firqə isə imamın istər Həsənin, istərsə də Hüseynin nəslindən çıxacağını və bunun irəli çıxıb kütləlləri öz arxasınca aparacaq kəs olduğunu dedilər. Əli Zeynulabidin vəfat etdikdə şiələrin çoxu onun oğlu Zeydin imam olduğunu dedilər. Şiələrin nə üçün Zeydi tərk edib qardaşı Muhəmməd əl-Baqiri imam görməkləri haqqında Nubəxti bir məlumat vermir, lakin tarix kitablarında məşhur olan budur ki, Zeyd bin Əli öz şiələrinin istəyinə tabe olmur və Əbu Bəkr və Əlinin xilafətini rədd etmir, onlara sevgisini ifadə edir və buna görə də şiələrin bir qismi onu tərk edirlər və qardaşı Muhəmmədin imam olduğunu deyirlər. Burada imami şiələr ilə zeydilər ayrılırlar. Zeydilər öz aralarında bir çox qola ayrılırlar, lakin əksəriyyəti Zeydin sonuncu imam olduğunu deyir, beləliklə də onlara görə

---

[1474] ən-Nubəxti, "Firaquş-Şiə", səh: 44; Məcmə əl-İmam əl-Hüseyn əl-İlmi, 1439

imamların sayı beşdir. Muhəmməd əl-Bəqiri imam olaraq görənlər isə o vəfat etdikdə iki firqəyə ayrıldılar. Bir firqə növbəti imamın Mədinədə qiyam etmiş və orada öldürülmüş Muhəmməd bin Abdilləh bin əl-Həsən bin Əli bin Əbi Talib olduğunu dedilər və dedilər ki, ölməyib, sağdır və əl-Aləmiyyə adlı dağdadır, gələcəkdə çıxacaq. Onun Mehdi olduğunu dedilər, çünki bir hədisdə peyğəmbər – aleyhissalətu vassələm – demişdi: "Çıxacaq Mehdinin adı mənim adım, atasının adı atamın adıdır." Digər firqə isə Muhəmməd əl-Baqir'dən sonra imamın onun oğlu Cəfər əs-Sadiq olduğunu dedilər. Cəfər əs-Sadiq hələ sağ ikən bir qrup onun imamlığından imtina etdilər; bunun səbəbi isə budur ki, Cəfər sağ ikən guya oğlu İsmail'i özündən sonra imam olaraq vəsiyyət edib, lakin İsmail atasından əvvəl vəfat edir və onun növbəti imam olacağını gözləyən bir qrup Cəfər əs-Sadiq'in yalan danışdığını deyərək onun imamlığını qəbul etmədilər. Digərləri isə "əl-bəd'u" inancını ortaya ataraq, hərfi mənada Allahın öz fikrini dəyişməsi mənasına gələn bu inanca görə imamlığın İsmaildən alındığını dedilər.

Cəfər əs-Sadiq vəfat etdikdə şiələr şiddətli ixtilafa düşdülər. Onların bir qolu dedi ki, Cəfər ölməyib, sağdır və Mehdi məhz odur və gələcəkdə təzədən zühur edəcək və insanlara imamlıq edəcək. Bu firqəyə "nəvusiyyə" deyirlər. İkinci firqə isə dedi ki, Cəfərdən sonra imam elə İsmaildir və onlar İsmailin öz atasının sağlığında öldüyünü inkar etdilər və dedilər ki, guya atası Cəfər öz oğlu İsmailin təhlükəsizliyi üçün onun ölüm xəbərini vermiş və yalandan cənazə namazı qılmışdır. Onlar İsmailin hələ də sağ olduğuna inanırlar, çünki atası Cəfər onun imam olduğunu vəsiyyət etmişdi və imam yalan danışmaz. Bunlar xalis "ismailiyyə" firqəsidir. Üçüncü firqə isə dedi ki, Cəfərdən sonra imam onun oğlu İsmail'dən olan nəvəsi Muhəmməd'dir, yəni Muhəmməd bin İsmail bin Cəfər'dir. Onlara görə əl-Həsən və əl-Hüseyn istisna olmaqla imamlıq Hüseynin nəslində atadan oğula keçir, qardaşdan qardaşa keçməz, beləliklə də İsmail öldüyü üçün, mütləq onun oğlu imam olmalıdır. Bu firqə "mubərakiyyə" olaraq tanınır. Mubərakilər firqəsindən bir qol ayrıldı və dedilər ki, Cəfərin ruhu Əbul-Xattab Muhəmməd bin Əbi Zeynəb əl-Əsədi'yə, ondan da sonra Muhəmməd bin İsmail bin Cəfərə keçib. Onlara görə imamlıq Muhəmmədin nəslində davam edir. İsmaili firqəsindən ayrılmış daha bir firqə "qarmati" (əl-Qaramitə) firqəsidir; onlara görə peyğəmbərdən sonra imamların sayı yeddidir və onlar Əli, əl-Həsən, əl-Hüseyn, Əli Zeynulabidin, Muhəmməd əl-Bəqir, Cəfər əs-Sadiq və Muhəmməd bin İsmail bin Cəfər'dir. Sonuncunu Mehdi və peyğəmbər hesab edirlər.

Dördüncü firqə dedi ki, Cəfər əs-Sadiq'dən sonra imam onun oğlu Muhəmməd bin Cəfərdir. əd-Diybəc ləqəbi ilə tanınan Muhəmməd bin Cəfər hicri 199-cu ildə xəlifə əl-Məmuna qarşı üsyan etmişdir. Onun imamlığına və imamlığın daha sonra onun nəslində davam etdiyinə inananlar "səmtiyyə" firqəsi olaraq tanınırlar. Beşinci firqə isə Cəfərdən sonra imamın onun oğlu Abdullah əl-Əftəh olduğunu dedilər, çünki Cəfər vəfat edərkən Abdullah onun övladları içində ən böyüyü idi. Bu firqənin nümayəndələri İmam Cəfərdən belə bir rəvayət gətirirlər ki, "imamlıq imamın övladlarından ən böyüyə aiddir." Cəfər əs-Sadiq vəfat etdikdə onun şiələrinin böyük əksəriyyəti Abdullah əl-Əftəh'in imamlığına etiqad etdilər. Bu firqənin adı "fətəhiyyə" olaraq tanınır. ən-Nubəxti deyir: "Şiələrin şeyxlərinin və fəqihlərinin əksəriyyəti bu firqəyə yönəldilər və imamlığın Abdullah bin Cəfər'də və ondan sonrakı övladlarında olduğuna şəkk etmədilər."[1475] Lakin Abdullah vəfat etdikdə özündən sonra erkək övladı buraxmadı və buna görə də az bir hissədən başqa əksər şiələr onun imamlığı rəyindən döndülər və qardaşı Musa bin Cəfərin imam olduğunu dedilər. Abdullahın imamlığına hələ də inananlar isə dedilər ki, o vəfat etdikdən sonra imamlıq kiçik qardaşı Musaya keçmişdir. Cəfər əs-Sadiqdən sonra imamın oğlu Abdullah yox, Musa olduğunu deyənlər beləliklə də altıncı firqəni təşkil edirlər. Onlar Musanın qardaşı Abdullahı imamlıq kürsüsünə oturduğu üçün xətalı hesab edirlər.

Musanın imamlığına inanan şiələr onun vəfatından sonra bir neçə firqəyə bölündülər. Musa əl-Kazim ikinci dəfə həbsə atıldıqda və orada vəfat etdikdə bir firqə iddia etdi ki, Musa vəfat edib və onun oğlu Əli ər-Rida imamdır. Bunlar imamlığın Əlinin nəslində davam etdiyini dedilər. İkinci firqə isə dedi ki, Musa ölməyib, sağdır və Yer üzünün hər yerinə başçılıq etmədən ölməyəcək və Mehdi odur. Bu firqənin bir hissəsinə görə Musa ölüb, lakin yenidən gələcək. Bu cür inanan şiə firqəsi "vaqifə" adı ilə tanındılar, çünki onlar imamlığın Musada vəqf etdiyinə, dayandığına inandılar. Bir firqə isə dedi ki, Musa ölməyib, sağdır və həbs olunmayıb, lakin imamlığını Muhəmməd bin Bəşir'ə verib və imamlıq artıq onun nəslində Musa yenidən zühur edənə qədər davam edir. Onlar "bəşriyyə" adı ilə bilinirlər. Əli bin Musa'nın imam olduğunu deyənlər onun vəfatından sonra bir neçə firqəyə parçalandılar. Onlardan bir firqəyə görə Əli'dən sonra imam onun oğlu Muhəmməd olmalıdır və Muhəmmədi xəlifə əl-Məmun öz qızına

[1475] ən-Nubəxti, "Firaquş-Şiə", səh: 113; Məcmə əl-İmam əl-Hüseyn əl-İlmi, 1439

nişanlamışdı. Digər bir firqə isə dedi ki, imamlıq Əli bin Musa'dan sonra qardaşı Əhməd bin Musa'ya keçib. Bir firqə isə Əli bin Musa vəfat etdikdə onun imamlığını inkar etdilər və atası Musa bin Cəfər'in sonuncu imam olduğunu dedilər. Bunlara "muəlləfə" şiələr deyilir. Əli bin Musa'dan sonra şiələrin firqələrə parçalanmasının səbəbi özündən geriyə buraxdığı oğlu Muhəmməd'in sadəcə yeddi yaşının olması idi; onlar dedilər ki, imam yalnız həddi-büluğa çatmış biri ola bilər, çünki əgər Allah həddi-büluğa çatmamış birinə itaəti vacib görərsə o zaman buluğ yaşına çatmamış birini mükəlləf qılması gərəkdir, bu isə məqbul deyildir. Lakin Muhəmməd bin Əlinin imamlığını qəbul edənlər o vəfat etdikdə çoxluqla oğlu Əli bin Muhəmmədi imam kimi qəbul etdilər, lakin kiçik bir hissə Muhəmmədin qardaşı Musanın imam olduğunu dedi. Onlar az bir müddət mövcud oldular, daha sonra isə Əli bin Muhəmmədin imam olması ilə razılaşdılar. Əli bin Muhəmməd əl-Hədi vəfat etdikdə bir firqə onun oğlu Muhəmmədin imam olduğunu dedilər, amma Muhəmməd hələ atası sağ ikən vəfat etmişdi, lakin atası onun imam təyin etdiyi üçün onun imamlığına etiqad etməyə davam etdilər, onun sağ olduğunu dedilər. Xalis ismaili şiələrin İsmail bin Cəfər haqqında dediklərini bunlar Əli əl-Hədi'nin oğlu Muhəmməd haqqında dedilər. Geridə qalan şiələr isə onun hələ də sağ olan oğlu əl-Həsən bin Əlinin imam olduğunu dedilər. Şiələrin kiçik bir hissəsi isə növbəti imamın Əli əl-Hədi'nin digər oğlu Cəfər bin Əli olduğunu dedilər.

əl-Həsən əl-Askərinin imam olduğuna etiqad edənlər onun vəfatından sonra çox şiddətli bir ixtilafa düşdülər. ən-Növbəxti yazır ki, "əl-Həsən bin Əli (əl-Askəri)... ikiyüz altmışıncı ildə vəfat etdi və evində, atasının basdırıldığı evdə dəfn olundu və onun iyirmi səkkiz yaşı var idi... öldükdən sonra onun heç bir izi görülmədi, üzdə hansısa bir övladı bilinmədi, ona görə də mirasından bilinənlər qardaşı Cəfər və anası arasında bölüşdürüldü..."[1476] ən-Növbəxti həmçinin deyir ki, onun ölümündən sonra şiələr on dörd firqəyə parçalandılar. Onlardan bir firqə dedi ki, əl-Həsən bin Əli sağdır, ölməyib, qeybə çəkilib, ölməsi caiz deyildir. Yer üzü imamsız qala bilmədiyi üçün, onun özündən sonra övladı olmadığı üçün onun ölməməsi, imam olaraq qalması labüddür. İkinci firqə isə dedi ki, əl-Həsən ölüb, lakin yenidən həyata qayıdıb və Mehdi odur. Övladı olmadığı üçün yenidən yaşaması və Mehdi olması zəruridir. Üçüncü firqə dedi ki, əl-Həsən bin Əli həqiqətən ölüb və özündən sonra qardaşı Cəfəri imam olaraq vəsiyyət edib. Dördüncü firqə dedi ki, əl-Həsənin özündən sonra övlad

[1476] ən-Nubəxti, "Firaquş-Şiə", səh: 136-137; Məcmə əl-İmam əl-Hüseyn əl-İlmi, 1439

buraxmaması onun imam olmadığını göstərdi, həqiqi imam Cəfər idi və ona imamlığı atası Əli əl-Hədi vəsiyyət etmişdi. Beşinci firqə isə əl-Həsən vəfat etdikdə atası Əlinin sağlığında ölmüş oğlu Muhəmmədin imamlığına qayıtdılar və onun imam olduğunu dedilər. Çünki atası onu vəsiyyət etmişdi və onun özündən sonra övladı qalıb. Altıncı firqə isə dedi ki, əl-Həsən bin Əli'nin əslində oğlu olub, adını da Muhəmməd adlandırıb. Onun atasının vəfatından iki il əvvəl doğulduğunu və Mehdi olduğunu dedilər.Yeddinci firqə isə dedi ki, kim əl-Həsənin öz sağlığında uşağının olduğunu iddia edərsə yalan danışır, amma doğrudur ki, onun oğlu olub, lakin vəfatından səkkiz ay sonra dünyaya gəlib. Özü də uşağı doğulduqda ona Muhəmməd adının qoyulmasını istəmişdi. Səkkizinci firqə dedi ki, əl-Həsən ölüb, özündən sonra uşaq buraxmayıb, lakin hamilə bir kəniz tərk edib və o, mövcuddur, uşağı dünyaya gətirəndə gətirəcək. Doqquzuncu firqə dedi ki, əl-Həsən ölüb, həmçinin onun ataları da ölüb və əl-Həsən özündən sonra imam tərk etməyib, beləliklə də imamlıq xətti kəsilib, çünki Allah insanlara qəzəbləndiyi üçün imamlıq məqamını onlardan alıb. Lakin gələcəkdə peyğəmbərin nəslindən bir imam çıxacaq. Onuncu firqə isə ümumiyyətlə əl-Həsən'in imamlığını inkar etdilər və qardaşı Muhəmməd bin Əli'yə qayıtdılar; dedilər ki, Atası Əli imamlığı ona vəsiyyət etmişdi, o da atasının Nəfis adlı bir xadiminə vəsiyyət etmişdi, o isə imamlığı Muhəmmədin və əl-Həsənin qardaşı Cəfərə təhvil verdi. Bu firqə əl-Həsən bin Əlinin əleyhinə ağır sözlər işlədirlər, onu təkfir edirlər. Qardaşı Cəfəri isə çox ucaldırlar, onun Mehdi olduğunu deyirlər. On birinci firqə isə əl-Həsənin imamlığını təsdiq etdilər, lakin dedilər ki, ondan sonrakı imamın kim olduğunu bilmirik və təvəqquf edirik. On ikinci firqə isə - ən-Növbəxti'yə görə - imamiyyə firqəsidir ki, onlara görə əl-Həsən əl-Askəri ölüb və onun özündən sonra övladı vardır və imam odur; lakin onun haqqında bilmirik, adını çağırmaq olmaz, onun işi gizlidir. Bəzi kəslərin onunla qarşılaşdığını iddia etdilər. On üçüncü firqə isə dedi ki, əl-Həsən'dən sonra imam onun qardaşı Cəfərdir. ən-Növbəxti'nin kitabı on üçüncü firqə barəsində verdiyi məlumatla bitir, on dördüncü firqə haqqında bir şey yazmır. əl-Askəri'nin vəfatı ilə şiələrin düşdükləri ixtilaf və istidam dönəmini şiə kitablarında "heyrət" dövrü adlandırırlar. ən-Nuri ət-Təbərsi yazır: "Heyrət ilə qəsd olunan qeyb zamanıdır və bu, əl-Askəri'nin vəfat etdiyi və şiələrin heyrətə düşdükləri ildir."[1477] Ey şiə qardaşım, məgər dindən zəruri olaraq bilinən bir məsələdə bu qədər ixtilafın olması

[1477] ən-Nuri, "Xatimətu Mustədrak əl-Vasəil", 4/44; Muəssəsətu Al əl-Beyt, 1429

normaldırmı? Allahın ayəsini xatırladıram: "Əgər o, Allahdan başqası tərəfindən olsaydı, əlbəttə, onda çoxlu ixtilaf tapardılar."[ən-Nisa, 82]

## İmamların sayı və kimliyi

Xəbərlərin hamısı onu göstərir ki, o dövrdəki şiələrdə imamlar haqqında heç bir tutarlı məlumat olmayıb, ona görə də bu qədər heyrət içində olublar. Şiə alimi Əbul-Qasim əl-Xoyi iddia edir ki, "sünnilər və şiələr tərəfdən bizə gəlib çatmış mütəvatir rəvayətlər imamları say baxımından on iki olaraq məhdudlaşdırıb, lakin onların adlarını bir-bir müəyyən etməyib."[1478] əl-Xoyi çox gözəl başa düşür ki, əgər şiələrdə imamların adları ilə bağlı etibarlı hədislər olsaydı şiələr bu qədər parçalanmazdılar. Nəinki adi şiələr, hətta imamların ən yaxın tələbələri belə imamların adlarını bilməyiblər. Cəfər əs-Sadiqin – iddia olunduğuna görə - ən xas tələbələrindən olan Zurara misal üçün vəfat edərkən növbəti imamın kim olduğunu bilmirdi. Ona görə də oğlu Ubeydi son xəbərləri gətirmək üçün Mədinəyə göndərir, lakin oğlu qayıtmadan əvvəl vəfat edir. Vəfat etmədən əvvəl Quranı sinəsinə qoyaraq növbəti imamın Quran olduğunu deyir. Bu barədə olan xəbərləri əl-Kəşşi müxtəlif isnadlar ilə Zurara'dan rəvayət edir. Bir rəvayətdə Əli bin Yəqtin'dən belə dediyini rəvayət edir: "Əbu Abdilləh - aleyhissələm - vəfat etdikdə insanlar Abdullah bin Cəfərin imam olduğunu dedilər. İxtilaf etdilər; onlardan kimisi onun, kimisi də Əbul-Həsən'in - aleyhissələm - imam olduğunu dedilər. Zurara oğlu Ubeydi çağırdı və ona dedi: "Ey oğlum, insanlar bu məsələdə ixtilaf ediblər; onlardan kim Abdullahın imam olduğunu deyirsə "imamət, imamın oğullarından yaşca ən böyük olandadır" xəbərinə əsaslanır. Miniyini hazırla və Mədinəyə get ki, bizə məsələdə doğru olan xəbəri gətirəsən." Hazırlandı və Mədinəyə yola düşdü. Bundan sonra Zurara xəstələndi, ölüm yatağına düşdükdə Ubeyd'i soruşdu. Hələ gəlib çatmadığını dedilər. Quranın gətirilməsini istədi və dedi: "Allahım, Sən peyğəmbərin Muhəmmədə nazil etdiklərində, onun dili ilə bəyan etdiklərində onun gətirdiyi hər şeyi təsdiqləyirəm və mən Sənin ona bu

[1478] əl-Xoyi, "Siratun-Nəcət fi Cəvibətul-İstiftəət", 2/453; Darul-İtisam, 1417

kitabda endirdiklərini təsdiqləyirəm. Mənim etiqadım və dinim oğlum Ubeydin gətirəcəyi xəbər və Sənin Öz kitabında bəyan etdiklərindir. Əgər məni bundan əvvəl öldürsən bu mənim özüm barəmdə şahidliyim və oğlum Ubeydin gətirəcəyi xəbərin təsdiqidir. Səni buna şahid tuturam."[1479] Bu uzun xəbərin isnadında məchul ravilər olsa da əl-Kəşşi bu barədə Zurara'dan bu xəbəri yeddi fərqli isnadla zikr edir. Onlardan birində əl-Kəşşi deyir: "Həmdəveyh bin Nuseyr (dedi) : Muhəmməd bin İsa bin Ubeyd mənə Muhəmməd bin Əbi Umeyr'dən, o da Cəmil bin Durrac və başqalarından rəvayət etdi; dedi: "Zurara öz oğlu Ubeydi Mədinəyə göndərdi ki, (İmam Cəfərin oğulları olan) Əbul-Həsən (Musa əl-Kazım)ın və (digər oğlu) Abdullah bin Əbi Abdilləh'in xəbərini öyrənib gətirsin. Lakin Ubeyd qayıdıb gəlmədən əvvəl öldü."[1480] Bu rəvayətin isnadındakı ravilər şiə ricəl alimlərinə görə siqadır. Şiə alimlərindən kiminsə Zurara ilə bağlı gəlmiş bu xəbərləri inkar etdiklərini bilmirik, əksinə bu xəbərlərin doğruluğunu təsdiqləyirlər. Hətta Şeyx Muhəmməd Asif əl-Muhsini yazır: "Lakin çox təəccüblüdür ki, əl-Baqir və əs-Sadiq ilə - aleyhimussələm - qədimdən bağlantısı olan, seçkin elmi bir məqamı olan Zurara kimi biri (İmam) əs-Sadiq'dən - aleyhissələm - sonrakı imamın kim olduğunu, hətta sonuncu imama qədər geridə qalan digər imamların kimliklərini necə bilmirdi?! Bu bilik Zurara kimi birinə vacib olmasa da Zurara kimi birinin bundan cahil olması yenə də təəccüblüdür."[1481] Bu heyrət təkcə Zurara'nın halı deyildi, digər şiələr də bu problemlə üzləşmişdilər. ət-Tusi "əl-Ğeybə" kitabında İmam Cəfərdən sonra oğlu Musanın imamətində şəkk etmiş şiələrin arasında Abdurrahmən bin əl-Həccac, Rifaə bin Musa, Yunus bin Yaqub, Cəmil bin Durrac və Həmməd bin İsa'nın adlarını çəkir, onların İmam əs-Sadiq'in əshabından olduğunu deyir. Bura həmçinin Əhməd bin Muhəmməd bin Əbi Nasr və əl-Həsən bin Əli əl-Vaşşa'nı əlavə edir.[1482] ən-Növbəxti də şiələrin firqələri haqqında yazdığı kitabda xəbər verir ki, "Əbu Abdilləh Cəfər bin Muhəmməd - aleyhissələm - vəfat etdikdə onun şiələri ondan sonra altı firqəyə parçalandılar." Bunlardan "bir firqə dedi ki, Cəfər bin Muhəmməd diridir, ölməyib və zühur edənə qədər diri olacaq…" Bir başqa firqə isə "iddia etdi ki, Cəfər bin Muhəmməd'dən sonrakı imam oğlu İsmail bin Cəfər'dir. Onlar İsmail'in atasının sağlığında ölmüş olduğunu inkar etdilər." Bir başqa

---

[1479] ət-Tusi, "İxtiyəru Mərifətir-Ricəl", 1/405-406;

[1480] Eyni mənbə, 1/409;

[1481] əl-Muhsini, "Mucəm əl-Əhədis əl-Mutəbəra", 1/136-137;

[1482] ət-Tusi, "əl-Ğeybə", səh: 71;

firqə imamlığın İsmail'in oğlu Muhəmməd'də olduğunu dedilər. Dördüncü firqə isə imamın Cəfər'in oğlu Muhəmməd olduğunu dedilər; Muhəmməd, Musa və İshaq bir anadan olmuşdular. Beşinci firqə isə dedi ki, İmam Cəfər'dən sonrakı imam onun oğlu Abdullah əl-Əftah'dır, çünki Abdullah sağ qalan oğulları içində yaşca ən böyük olan idi. ən-Növbəxti deyir ki, "az bir nəfər istisna olmaqla atası Cəfər bin Muhəmməd'in imamlığına etiqad edənlərin əksəriyyəti Abdullahın imam olduğunu dedilər."[1483] Altıncı və axırıncı firqə isə imamın Musa əl-Kazım olduğunu deyilər. Abdullah atasının ölümündən qısa bir zaman sonra ölür və bundan sonra şiələrin əksəriyyəti tədricən Musa əl-Kazım'ın imam olması fikri üzərinə gəlirlər. Bu və bu kimi xəbərlər qəti şəkildə dəlalət edir ki, bu dövrdə yaşamış şiələr, imamların kim olduğunu bilmirdilər, ona görə də öz aralarında bu qədər ixtilaf ediblər və çox sayda firqəyə parçalanıblar. Hətta nəinki "ən xas tələbələr", imamlar özləri belə bundan xəbərsiz idilər, çünki – şiələrin öz rəvayət etdiklərinə görə - Cəfər əs-Sadiq əvvəl bir oğlunu imam olaraq vəsiyyət etmiş, lakin o, həyatında vəfat etmişdi. Bu barədə əl-Kuleyni rəvayət edir ki, Əbu Bəsir deyib: "Mən Əbu Abdullahın - aleyhissələm - yanında idim və vəsilərin (vəsilər) məsələsi müzakirə edildi, mən İsmaili xatırladım. O dedi: "Xeyr, Allaha and olsun, ey Əbu Məhəmməd, bu bizə aid deyil, bu yalnız Uca və Qüdrətli Allaha aiddir ki, birini digərinin ardınca təyin edir."[1484] Bu sözləri şərh edən əl-Məzəndərani deyir: ""Mən İsmaili xatırlatdım" ifadəsi İsmail ibn Cəfər ibn Məhəmməd əl-Baqiri nəzərdə tutur. O, saleh bir insan idi və Əbu Basir və digər Şiələr onun atasının varisi olacağını zənn edirdilər. Buna görə də, Əs-Sadiq - aleyhissələm - onun ölümündən sonra dedi: "Heç bir şey oğlum İsmaildə Allaha göründüyü kimi görünməmişdir." Bu, Allahın, atasından sonra onun imam olmasına hökm verdikdən sonra bu hökmündən dönməsi və ya peşman olması mənasında deyil. Axı bu necə mümkün ola bilər ki, halbuki imam özü deyib: "Kim Allahın bir işdə peşman olaraq fikir dəyişdiyini iddia edirsə, o, bizim yanımızda böyük Allaha qarşı kafirdir!" Əslində, məna (Şeyx) əs-Saduqun - rahiməhullah - işarə etdiyi mənadır və hasili budur ki, "Allah oğlum İsmaildə etdiyi kimi başqa heç bir şeydə insanlara gizli olan bir şeyi üzə çıxarmamışdır, beləki məndən qabaq onun canını aldı və öldürdü ki, onun məndən sonra imam olmadığını bilsinlər."[1485] əs-Saduq'un

[1483] ən-Növbəxti, "Firaq əş-Şiə", səh: 113-127;

[1484] əl-Kuleyni, "əl-Kəfi", 1/277;

[1485] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 6/89;

verdiyi izah bir problemi həll etsə də eyni dərəcədə önəmli olan digər bir problemi həll etmir; axı nə üçün şiələr - xüsusilə də Əbu Bəsir kimi "xas tələbələr" - Cəfər əs-Sadiq'dən sonra kimin imam olacağını bilmirdi?! Əgər həqiqətən də Allahın elçisindən - salləllahu aleyhi va əlihi va səlləm - bu barədə rəvayət var idisə sadəcə olaraq bunu Əbu Bəsirə və digər şiələrə xəbər vermək kifayət edəcəkdi, İsmailin atası Cəfərdən sonra imam olmadığını bəyan etmək üçün onu öldürməyə ehtiyac qalmayacaqdı. Bəlkə düşünmək olar ki, İmam Cəfərin zamanında bu barədə hədislər hələ yayılmamışdı, məşhur deyildi, ona görə də Əbu Bəsir, Zurara və digərləri bunu bilmirdi. Belə bir cavab nə qədər absurd olsa da biz arqument xatirinə bunun doğru olduğunu fərz edək. O zaman nə üçün eyni problem onuncu imamın övladlarında da yaşandı. əl-Kuleyni'nin rəvayət etdiyi bir xəbərdə "Məhəmməd ibn Yəhya və başqaları, Səd ibn Abdullah vasitəsilə, Haşimilərin bir qrupundan, o cümlədən Həsən ibn Həsən əl-Aftasdan belə nəql edir: Onlar Məhəmməd ibn Əli ibn Məhəmmədin vəfat etdiyi gün Əbu Həsənin evinə başsağlığı verməyə gəldilər və onun evinin həyətində oturmaq üçün bir yer ayrılmışdı, qadınlar ətrafda oturmuşdu. Dedilər: "Əbu Talibin ailəsindən, Bəni Haşim və Qüreyşdən, xidmətçilərini və digər insanları çıxmaqla, ətrafında təxminən 150 kişi var idi." Sonra Həsən ibn Əlini gördülər, o, cırılmış paltarla gəldi və Əbu Həsənin sağında dayandı, amma biz onu tanımırdıq. Bir müddət sonra Əbu'l-Həsən - aleyhissələm . ona baxdı və dedi: "Oğlum, Allaha şükür et, çünki O sənə böyük bir iş bəxş etdi." Gənc ağladı, Allaha həmd etdi və dedi: "Bütün təriflər aləmlərin Rəbbi Allaha məxsusdur və mən Allahdan bizə verdiyi nemətləri sənin vasitənlə tamamlamağı diləyirəm. Həqiqətən, biz Allaha məxsusuq və Ona dönəcəyik." Biz onun haqqında soruşduq, dedilər: "Bu onun oğlu Həsəndir." Onun yaşının təxminən iyirmi və ya bir qədər çox olduğunu hesab etdik. O gün biz onu tanıdıq və anladıq ki, ona İmamət verilmiş və atasının yerinə qoyulmuşdur." əl-Kuleyni'nin bundan bir qədər sonra gətirdiyi xəbərdə Əbu Həşim əl-Cəfəri deyir: "Əbu'l-Həsənin - aleyhissələm - oğlu Əbu Cəfər dünyasını dəyişəndən sonra mən onun yanında idim və öz içimdə düşünürdüm, demək istəyirdim: "Bu dövrdə bu ikisi, yəni Əbu Cəfər və Əbu Məhəmməd sanki Cəfər bin Muhəmməd'in iki oğlu Əbu Həsən Musa və İsmail - aleyhimussələm - kimidirlər və hekayələri də onların hekayəsinə bənzəyir, Əbu Cəfərdən - aleyhissələm - sonra Əbu Məhəmməd gözlənilən imam idi. Əbu'l-Həsən mən danışmamışdan əvvəl mənə tərəf döndü və dedi: 'Bəli, ey Əbu Haşim, Allah Əbu Cəfərdən sonra Əbu Məhəmməd haqqında əvvəlcədən bilinməyən bir

şeyi bəyan etdi, necə ki, İsmailin ölümündən sonra Musa haqqında bəyan etmişdi və onun halını aşkara çıxarmışdı. Batil iddiaçılar bundan xoşlanmasa da məsələ sənin ürəyində düşündüyün kimidir. Əbu Məhəmməd, oğlum, məndən sonra xələfimdir. O, lazım olan biliklərə malikdir və onda imamət bacarığı vardır."[1486] əl-Məzəndərani xəbərdə Əli əl-Hədi'nin öz oğlu Həsənə "oğlum, Allaha şükür et, çünki O sənə böyük bir iş bəxş etdi" deməsi ilə bağlı belə bir şərh verir: "Allah (oğlum) Muhəmmədin ruhunu alanda və şiələr onun atasından sonra İmam olduğunu zənn edəndə, Allah İmaməti səndə aşkar etdi və onu sənə məxsus etdi, onların arasındakı ixtilafları aradan qaldırdı. Bu, böyük bir nemətdir ki, şükrü vacib edir."[1487] əl-Məclisi isə belə izah edir: "Allah böyük qardaşının səndən əvvəl ölümü ilə səni İmam etdi və Onun iradəsi səndə təcəlli etdi."[1488] Əgər əl-Məclisi'nin izahı doğrudursa deməli heç İmam əl-Hədi'nin özü də övladının ölümünə qədər oğlu Həsənin imam olacağını bilmirdi. Bu rəvayətlərin hansı istiqamətdə təvil olunmasından asılı olmayaraq ortada bir fakt israrla dirənməkdədir: imamların ən xas tələbələri belə növbəti imamın kimliyindən xəbərsiz idilər. Göründüyü kimi hələ də şiələrdə on iki imamın kimliyi haqqında məlumat yox idi. Ona görə də zeydilər və mötəzililər imamlar haqqında iddia olunan bu xəbərlərin yalan olduğunu bu tarixi faktlara əsaslanaraq deyirlər. Zeydi alimi əl-Hakim əl-Cuşəni yazır: "Onların on iki imam barəsində açıq-aşkar nass olduğunu deməklərinə gəldikdə isə, onların öz məzhəblərindən məlumdur ki, imamlarından hər bir imam öldükdən sonra ixtilaf etdilər. Əgər aşkar bir nass olsaydı ixtilaf etməzdilər."[1489] Həmçinin İbnud-Dəmiğani yazır: "Məlumdur ki, onların öz arasında (imamların) təyinatı sabit olmuş olsaydı təyin olunmuş şəxsin kimliyi üzərində ixtilaf etməzdilər və məlumdur ki, onlar Cəfər əs-Sadiq'in vəfatından sonra övladlarının sayı qədər firqələrə parçalandılar; navusilər, fətahilər, səmtilər, musəvilər və ismaililər."[1490]

əl-Xoyi iddia edir ki, imamların sayları bilinirdi, lakin əl-Xoyi'nin əsaslandığı səbəb nəinki adların, hətta sayların da bilinmədiyini gərəktirir. Bu həqiqəti Şiə alimlərindən Muhəmməd Bəqir əl-Bəhbudi etiraf edir və deyir: "İmamların kimliyini müəyyən edən hədislərin

---

1486 əl-Kuleyni, "əl-Kəfi", 1/326-327;

1487 əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 6/219;

1488 əl-Məclisi, "Mirətul-Uqul", 3/288;

1489 əl-Cuşəni, "ər-Risələ fi Nəsihətul-Amma", səh: 61;

1490 İbnud-Dəmiğani, "əl-Cəvhəra əl-Xalisa", səh: 119; Al-Kamel Verlag, Köln, 2008

hamısı – istər (Fatimədən gəlmiş) lövh hədisi olsun, istərsə başqası - "qeyb" və "heyrət" dönəmlərində, və bundan bir az əvvəl uydurulmuşdur. Əgər bu rəvayətlər imami şiələrin arasında mövcud olsaydı, yayğın olsaydı pak imamların kimliyini bilməkdə bu dərəcə çirkin şəkildə ixtilaf etməzdilər və məzhəbin dirəyi sayılan alimlər, hədislərin rükunları sayılan alimlər uzun illər boyunca ixtilaf etməzdilər və (imamın) qeyb(ə çəkildiy)ini isbat etmək üçün, ümmətin qəlblərindən heyrəti dəf etmək üçün kitablar yazmağa tələsməzdilər…"[1491] əl-Behbudi sözünün doğruluğuna bir xəbəri misal olaraq gətirir. Bu xəbəri əl-Kuleyni "Usulul-Kəfi" kitabında zikr edir və deyir: "Muhəmməd bin Yəhya mənə Muhəmməd bin əl-Həsən əs-Saffar'dan, o da Əhməd bin Əbi Abdilləh'dən, o da Əbu Haşim'dən eynisini rəvayət etdi. Muhəmməd bin Yəhya dedi: "Muhəmməd bin əl-Həsən'ə dedim: "Ey Əbu Cəfər, kaş ki, bu xəbər Əhməd bin Əbi Abdilləh'dən başqa bir kimsədən gələrdi." Dedi: "Bunu mənə heyrətə düşmədən on il əvvəl rəvayət edib."[1492] Bu rəvayətdən anlamaq olur ki, şiə ravi Muhəmməd bin Yəhya bu xəbəri rəvayət edən Əhməd əl-Bərqi'nin sidqinə etibar etmirdi, üstəlik açıq şəkildə görünür ki, on iki imam haqqında xəbər əvvəllər mövcud olmayıb, çünki mövcud olsaydı yayılardı və heç kim şəkk içində olmazdı. əl-Məzəndərani'nin şərhinə qeydlər yazmış şiə alimi Mirzə Əbul-Həsən əş-Şərani bu hədislə bağlı deyir: "Bu hədis möminlərin əmirinin - aleyhissələm - zamanından ravilərin yanında tədavüldə deyildir, əgər belə olsaydı kitablarda çox-çox nəql olunardı və yayılardı, halbuki biz bunu yalnız bu isnad ilə görmüşük…"[1493] Hətta bu mərhələdə imamların sayı ilə bağlı rəvayətlər ortaya çıxmağa başladıqda bəzi rəvayətlər onların sayının on üç olduğunu qeyd edirdi. Həmin dövrdə ortaya çıxmış və Suleym bin Qeys əl-Hiləli'yə nisbət edilmiş kitabda keçən bir rəvayətdə - iddiaya görə - peyğəmbər möminlərin əmiri Əli bin Əbi Talibə deyir: "Sən və övladlarından on iki nəfər haqq imamlardır." Beləliklə də imamların sayı on üç olmalıdır.[1494] Bu, Əbu Cəfər Muhəmməd bin Osman əl-Uməri'nin nəvəsi olan Hibətullah bin Əhməd bin Muhəmməd əl-Katib'i bu barədə xüsusi kitab yazmağa sövq etdi və həmin kitabda imamların sayının on üç olduğunu, onlardan birinin Zeyd bin Əli olduğunu isbat etməyə

---

[1491] əl-Behbudi, "Mərifətul-Hədis", səh: 172; Darul-Hədi, 1427

[1492] əl-Kuleyni, "əl-Kəfi", 1/338; Mənşurat əl-Fəcr, 1428

[1493] əl-Məzəndərani, "Şərh Usul əl-Kəfi", 7/361;

[1494] Kitabın çap olunmuş versiyasında on iki sözü dəyişdirilərək on bir edilib.

çalışdı.[1495] Həmçinin Ibnun-Nədim məşhur "əl-Fihrist" kitabında Əbu Səhl ibn Növbəxt haqqında danışarkən onun on ikinci imam haqqında xüsusi bir rəyə sahib olduğunu yazır; qeybə çəkilmiş on ikinci imamın qeybdə öldüyünü və onun yerinə oğlunun imam olduğunu deyərmiş.[1496] İmamların adlarını bir kənara qoyaq, əgər onların sayı - iddia olunduğu kimi - mütəvatir və ya səhih yollarla sabit olsaydı hamıdan əvvəl şiə alimləri bu nöqtədə bu cür ixtilafa düşməzdilər. Üstəlik Hüseyn əl-Mudərrasi ət-Tabətabəi on iki imam inancının tədricən formalaşdığına dəlalət edən tarixi bir həqiqəti etiraf edir. Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - sonra gələcək xəlifələrin sayının on iki olacağını xəbər verən hədisin sünnət əhlinin kitablarında keçməsinə baxmayaraq ilk üç əsrin şiə alimləri bu hədisə yaxın durmayıblar, kitablarında bu hədisə yer verməyiblər. əl-Mudərrasi deyir ki, "on iki imam məzhəbinin haqqaniliyinə dəlalət edən ən güclü dəlil, şiələrin özlərinin əsrlər boyunca ehmal etdikləri bu dəlildir…"[1497] Nəinki sünnət əhlinin qaynaqlarında keçən xüsusilə bu hədisə, ümumiyyətlə imamların sayının on iki olması ilə bağlı heç bir xəbərə, heç bir məlumata yer vermirlər. Çox maraqlıdır ki, Muhəmməd Baqir əs-Sistani də eyni tarixi həqiqəti etiraf edir və deyir: "Ümumi göstəricilər sırasına Peyğəmbərin on iki imamın olacağı ilə bağlı qabaqcadan verdiyi xəbərlər də daxildir. Bu xəbərlərə uyğun gələn yeganə nümunəni biz yalnız Əhli-beytdən olan on iki imamda tapa bilirik. Və bu məsələni şiələr, rəvayətlərin mövcud olmasına baxmayaraq, əvvəlcə diqqətə almamışdılar, lakin imamın qeybə çəkilməsindən sonra açıq şəkildə fərq etdilər."[1498] Əlbəttə ki, şiələrdə on iki imam etiqadı olsaydı qeybət dönəmindən sonra yox, əvvəl bu rəvayətlərə fikir verərdilər. əl-Mudərrasi qeyd edir ki, Növbəxt ailəsindən olan alimlərin günümüzə qədər gəlib çatmış kitablarında imamların sayının on iki olmasına dair bir əsər, bir xəbər yoxdur. Həmçinin nə Sad bin Abdilləh əl-Əşari, nə də İbn Qibə'nin əlimizə keçmiş kitablarında[1499] bu barədə bir rəvayət qeyd edilmir. Onların

---

[1495] əl-Katib, "Tətavvur əl-Fikr əs-Siyəsi əş-Şii", səh: 255; əd-Dar əl-Arabiyyə lil-Ulum, 1426

[1496] ən-Nədim, "Kitəb əl-Fihrist", səh: 225; Rza Təcəddüdün təhqiqi

[1497] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə", səh: 160;

[1498] əs-Sistani, "Mənhəc əl-Bəhs vat-Təhərri fi Şən əl-İməm əl-Mehdi", səh: 116;

[1499] Bununla o, Əbu Səhl ən-Növbəxti'nin "ət-Tənbih" kitabından qalan hissəni, Əbu Muhəmməd bin Həsən bin Musa ən-Növbəxtinin "Firaq əş-Şiə" kitabında buna xas olan hissəsini, həmçinin Sad bin Abdilləh əl-Əşari'nin "əl-Məqalət val-Firaq" kitabında buna bənzər yerləri, eləcədə onun "Nəsix əl-Quran" kitabını və kitabın axırında gələn İbn Qibə'yə aid olan üç risaləni qəsd edir.

hamısı üçüncü əsrin sonlarında yaşayıblar.[1500] On iki imamın sayı və adları ilə bağlı şiə kitablarında keçən xəbərlərdən birində Xıdır - iddiaya görə - Əli və oğlu Həsənə onlardan sonra gələcək imamların adını və sayını bildirir, lakin bu xəbəri "əl-Məhəsin" kitabında gətirən əl-Bərqi onu tamamilə fərqli şəkildə verir; orada nə imamların sayı, nə də Həsən və Hüseyndən sonra gələn imamların adları keçmir.[1501] Başqa cür desək daha qədim qaynaqlarda say və adlar olmadığı halda eyni hədis üçüncü əsrdən sonrakı kitablarda ad və say əlavə olunaraq dəyişdirilib. əl-Bərqi'nin kitabında xüsusilə maraqlı olan budur ki, kitabın əvvəlində açdığı "əl-əşkəl val-qarain" babında müxtəlif saylar haqqında gəlmiş rəvayətləri qeyd edir; üçdən ona qədər keçən rəqəmlərin hər biri haqqında birdən çox xəbər rəvayət edir, lakin on iki rəqəmi ilə bağlı və o rəqəmin əhəmiyyəti haqqında heç bir şey qeyd etmir. Amma əl-Bərqi'dən bir əsr sonra yaşamış əs-Saduq "əl-Xisal" kitabında fərqli rəqəmlərin əhəmiyyəti haqqında hədisləri qeyd edərkən on iki rəqəmi üçün uzun bir yer ayırır və orada artıq on iki imamla bağlı hədisləri gətirir.[1502] əl-Mudərrasi özü ilk üç əsrdə "şiələrin bu hədisə", yəni sünni qaynaqlardakı on iki xəlifə haqqında gəlmiş hədisə "əhəmiyyət verməməklərini" belə izah edir ki, "şiələrin hamısı imamlar silsiləsinin aləmin sonuna qədər davam edəcəyinə etiqad edirdilər və imamların sayının bundan xeyli çox olacağını gözləyirdilər."[1503] Bununla belə əl-Mudərrasi bunun problem olmadığını deyir; onun izahına görə imamlar və imamların ən xas tələbələri - Zurara'nı misal olaraq verir - təqiyyə edərək özlərini imamların sayından və kimliyindən qafil olaraq göstərirdilər, guya həqiqətdə onlar imamların sayının neçə olacağını, kimlər olacağını bilirdilər, lakin bu bilikləri gizli saxlamaq adına bu cür davranırdılar.

Biz onu da əlavə edə bilərik ki, imamların sayı ilə bağlı rəvayətlər həmçinin Abdullah bin Cəfər əl-Himyəri'yə nisbət edilmiş "Qurb əl-İsnəd" kitabında, Əli bin əl-Hüseynə nisbət edilmiş "Səhifətus-Səccad" kitabında, Əliyə nisbət edilmiş "Nəhcul-Bələğa" kitabında da yoxdur. "Burada əl-Mudərrasi bəzi istisnaların olduğunu, yəni on iki imamla bağlı hədisin bu dönəmdən əvvəl yaşamış şəxslərə nisbət edilmiş kitablarda olduğunu deyir. Bunlardan birincisi Abbad bin Yaqub ər-

---

[1500] Eyni mənbə, səh: 159-160

[1501] Andrew J. Newman, "The Formative Period of Twelver Shi'ism", səh: 59; Routledge, London, 2000

[1502] Etan Kohlberg, "In Praise of the Few", səh: 215;

[1503] əl-Mudərrasi, "Tətavvur əl-Məbəni əl-Fikriyyə", səh: 158;

Ravvacəni'yə (vəfatı h. 250) nisbət edilən və "əl-Usul əs-Sittə Aşara" (On Altı Üsul Qaynaq) toplusunda çap edilmiş kiçik bir risalədir. Risalədə on doqquz hədis keçir və onların arasında on iki imamın mövcudluğuna dair hədis var. Bu risalə Abbad əl-Usfuri'nin əsli olaraq tanınır. əl-Mudərrasi bu istisnanın keçərli olmadığını onunla izah edir ki, Abbad bin Yaqub imami şiəsi olmayıb, sanki əl-Mudərrasi bu qaynağı şiə qaynaq kitab hesab etmir. Lakin doğru olan budur ki, Abbad əl-Usfuri'nin bu əsli, şiə kitablarından biridir. Lakin əl-Behbudi bu risaləni uydurulmuş kitablar arasında gətirir və qeyd edir ki, bunu rəvayət edən Əbu Səminə'dir, yalançı olmaqda ittiham olunub.[1504] İkinci istisnanın Əli bin İbrahim əl-Qummi'nin təfsiri olduğunu qeyd edən əl-Mudərrasi bu kitabda Xıdır hədisinin keçdiyini xatırladır. Əlavə edir ki, əl-Bərqi'nin kitabında, yəni daha qədim qaynaqda eyni hədis imamların sayı və adları olmadan keçməkdədir. Üstəlik qeyd edir ki, bu istisna keçərli deyildir, çünki əl-Qummi'nin kitabı onun özünə aid deyildir və özü də imamların sayının tamamlandığı bir dövrdə yaşayıb; o dövrdə artıq on iki imam məfhumu və sonuncunun Mehdi olması təsəvvürü şiələr arasında yayılmışdı.[1505] Üçüncü və sonuncu istisnanın Süleym bin Qeys əl-Hiləli'nin kitabı olduğunu deyir. Daha əvvəl uydurulmuş kitablar haqqında danışarkən Süleym'in kitabı haqqında da kifayət qədər məlumat verdik. Onu da qeyd edək ki, Süleymə nisbət olunan kitabda keçən hədis imamların sayının on iki yox, on üç olduğunu deyir.

Göründüyü kimi imami şiələrinin on iki imamla bağlı iddialarına qarşı bu və buna bənzər arqumentlərin əhdi qədimdir. Şiə alimləri hələ o zamandan bu problemdən agah idilər və buna çarə tapmağa çalışırdılar. Öz zamanında bu arqumentlərə qarşı cavab verməyə çalışanlardan biri də İbn Bəbəveyh əs-Saduq olub. O, bir yerdə deyir: "Zeydilər dedilər: On iki imam xəbəri səhih olsaydı, insanlar Cəfər bin Muhəmməd əs-Sadiq 'dən sonra imamətdə şəkk etməzdilər; halbuki şiələrdən bir tayfa (oğlu) Abdullah'ın, bir tayfa İsmail'in (imam) olduğunu dedilər, bir tayfa isə heyrət içində qalmışdı. Hətta şiələrdən kimisi əs-Sadiq'in oğlu Abdullahı imtahan etdil, onda istədiyini tapa bilmədikdə onun yanında çıxdıqda dedir: "Hara gedim? Mürciələrə yoxsa qədərilərə? Bəlkə hərurilərə qoşulum?" Musa bin Cəfər onun sözünü eşitdikdə dedi: "Nə mürciələrə, nə qədərilərə, nə hərurilərə, lakin mənim yanıma!" İndi baxın bu on iki imam xəbəri neçə yerdən

[1504] əl-Behbudi, "Mərifətur-Ricəl", səh: 364-365;

[1505] əl-Mudərrasi, "Tətavvur əl-Məbani əl-Fikriyyə", səh: 160;

batil çıxmış olur: Birincisi Abdullahın özünü imam yerinə qoyması, ikincisi şiələrin onun yanına gəlməkləri, üçüncüsü onu imtahan etdiklərində heyrətə düşməkləri, dördüncüsü isə Musa bin Cəfər öz imamlığına çağırmayana qədər imamın Musa olduğunu bilməməkləridir. Bu müddət ərzində şiələrin fəqihi Zurara bin Ayun mushaf sinəsində ikən belə deyərək öldü: "Allahım, mən bu mushaf kimin imamlığını isbat edirsə ona tabeyəm." əs-Saduq zeydilərin etirazını gətirdikdən sonra deyir: "Bunların hamısı aldatmaq üçün deyilmiş bəzəkli sözlərdir. Çünki biz iddia etməmişik ki, həmin əsrdə bütün şiələr on iki imamın hamısını adları ilə biliblər. Biz sadəcə olaraq demişik ki, Allahın elçisi - salləllahu aleyhi va səlləm - özündən sonra onun xəlifələri olmuş imamların sayının on iki olduğunu deyib və şiə alimləri bu hədisi onların adları ilə birlikdə rəvayət ediblər; onların içində bir və ya iki və ya daha çox kəsin bu hədisi eşitməmiş olması mümkündür. Zurara bin Ayun'a gəldikdə isə onun xəbər almaq üçün göndərdiyi şəxs yola düşmədən əvvəl ölmüşdü və Musa bin Cəfərin imam olaraq təyinatı xəbərini üzrünü aradan qaldıracaq şəkildə eşitməmişdi. Ona görə də Quranı sinəsinə qoydu və dedi: "Allahım, şübhəsiz ki, mən bu kitabda imamlığını isbat etdiyinə tabeyəm." Məgər dindar fəqih ona mövzu ixtilaflı qaldıqda elə məhz Zurara'nın etdiyi kimi etməməlidirmi?!"[1506] əs-Saduq əslində burada ortaya qoyulmuş problemi həll etmir, sadəcə olaraq sanki cavab verirmiş kimi müxaliflərini ittiham etdiyi işlə məşğuldur, yəni kitabını sözlərlə bəzəyir. Bizim bu dəyərləndirməmiz şiə oxuculara ağır gələ bilər, lakin özləri bu cavab üzərində düşünməlidirlər. Müxaliflərin şiələrdən soruşduqları budur ki, on iki imam və onların adları ilə bağlı rəvayət etdiyiniz bu xəbərlər səhih olsaydı nə üçün imamların ən böyük tələbələri olduğunu iddia etdiyiniz bu kəslər, ən məşhur və ən görkəmli aiimləriniz bunu bilmirdilər?! əs-Saduq əslində onların sualına cavab vermir, sadəcə olaraq deyir ki, o əsrdə şiələrin hamısının imamları adları ilə bildiklərini iddia etməyib. Halbuki burada məsələ şiələrin hamısının və ya bir hissəsinin imamları adları ilə bilib bilməsi deyildir, burada problem Zurara kimi bir nəfərin, İmam əl-Baqirə və İmam Cəfərə ən yaxın olduğu iddia edilən bir şiənin bundan cahil olmasıdır. əs-Saduq əslində bu nöqtəyə cavab vermir.

Onu da əlavə edək ki, əs-Saduq burada ikinci bir ehtimala da yer verir və deyir: "Üstəlik deyilib ki, oğlu Ubeydi yalnız ona görə

---

[1506] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", səh: 102-103;

göndərmişdi ki, Musa bin Cəfər'in kim olduğunu, onun imaməti barəsində bildiyini izhar etməyin icazəli olub olmadığını, yoxsa bunu gizlədərək təqiyyə etməsi lazım olduğunu öyrənsin. Zurara bin Ayun'un fəzilətinə və onun biliklərinə daha layiqli olan budur. Əhməd bin Ziyad bin Cəfər əl-Həmədəni bizə rəvayət etdi; dedi: "Əli bin İbrahim bin Haşim bizə rəvayət etdi; dedi: Muhəmməd bin İsa bin Ubeyd mənə İbrahim bin Muhəmməd əl-Həmədəni'dən belə dediyini rəvayət etdi: "(İmam) ər-Rida'ya - aleyhissələm - dedim: "Ey peyğəmbər övladı! Mənə Zurara haqqında xəbər ver; o sənin atanın haqqını tanıyırdımı?" Dedi: "Bəli!" Dedim: "Bəs o zaman nə üçün oğlu Ubeydi göndərdi ki, (İmam) əs-Sadiq Cəfər bin Muhəmməd'in kimə vəsiyyət etdiyinin xəbərini öyrənsin?" Dedi: "Zurara atamın halını, onun atasının onu (imam) təyin etdiyini bilirdi, oğlunu isə sadəcə olaraq ona görə göndərmişdi ki, atamdan onun imamlığını və təyinatını izhar etmək üçün təqiyyəni pozmasının caiz olub olmadığını öyrənsin. Oğlu gec gəldikdə isə ondan atam haqqındakı rəyini izhar etməsi tələb olundu və o, atamın göstərişi olmadan bunu etməyi xoş qarşılamadığı üçün mushafı qaldırdı və dedi: "Allahım, mənim imamım bu mushafın Cəfər bin Muhəmmədin övladlarından kimin imamətini təsdiqləyirsə odur!"[1507] Beləliklə də əs-Saduq imamın kim olması ilə bağlı Zurara'nın bundan xəbərsiz olduğunu təsdiq etdikdən sonra buna zidd bir izaha yer verir. Hər iki izah doğru ola bilməz, çünki birinci izah ikincisinə tamamilə ziddir. Üstəlik əs-Saduq bu ikinci izahı təqdim edərkən "deyilib ki" sözləri ilə bu izahı başqalarına nisbət edir. Maraqlıdır ki, nə üçün özü birbaşa bu izahı tək və yeganə izah kimi təqdim etmədi?! Ola bilsin ki, əs-Saduq dəlil olaraq İmam ər-Rida'dan gətirdiyi xəbərin səhih olmadığını bilir, çünki İmam ər-Rida'dan bunu rəvayət edən ravi İbrahim bin Muhəmməd əl-Həmədəni şiələrdəki ricəl əhlinə görə məchul biridir.[1508] Daha sonra əs-Saduq əlavə edir: "Zeydilərin dəlil gətirdikləri xəbərdə Zurara'nın Musa bin Cəfərin imamlığını bilmədiyinə dair bir şey yoxdur, orada keçən sadəcə budur ki, oğlu Ubeydi xəbər haqqında soruşmaq üçün göndərmişdi…"[1509] Xeyr, rəvayətlər çox aşkar şəkildə qeyd edir ki, Zurara öz oğlunu göndərərkən ona Cəfərin oğullarından kimin imam olduğunu öyrənməyi tapşırmışdı. Digər rəvayətlər də bu mənanı dəstəkləyir. Misal üçün Hişəm bin Səlim deyir: "Əbu Abdilləh öldükdən sonra biz -

[1507] Eyni mənbə, səh: 103;

[1508] əl-Cəvahiri, "əl-Mufid min Mucəm Ricəl əl-Hədis", səh: 15 (rəq: 293)

[1509] əs-Saduq, "Kəməlud-Din va Təməmun-Nimə", səh: 103;

mən və Muminut-Taq Əbu Cəfər - Mədinə şəhərində idik və insanlar atasından sonra imamlıq işinin sahibinin Abdullah olmasında icma etmişdilər. Beləliklə də biz onun yanına daxil olduq və insanlar onun yanında toplanmışdılar. Bunun səbəbi isə bu idi ki, onlar Əbu Abdilləh'dən rəvayət etmişdilər ki, "bir maneə/eyib olmadığı müddətdə bu iş imamın böyük oğlundadır." Yanına daxil olub atasından soruşduqlarımızı ondan soruşduq. Ondan zəkatın nə qədər hissədə vacib olduğunu soruşduq. Dedi ki, hər iki yüzə beş düşür. Soruşduq ki, bəs yüz olarsa? Dedi: "İki dirhəm və bir də yarı." Biz ona dedik: "Vallahi bu elə mürciələrin dediyidir." O da bunun üzərinə əlini göyə qaldırdı və dedi: "Xeyr, Allaha and olsun ki, mürciənin nə dediyini bilmirəm." (Hişəm bin Səlim) dedi: Onun yanından yolumuzu itirmiş kəslər olaraq çıxdıq; hara gedəcəyimizi bilmirdik. Mədinənin küçələrindən birində oturub ağladıq, heyrət içində idik; kimə gedəcəyimizi, kimə üz tutacağımızı bilmirdik. Bir-birimizdən soruşurduq ki, "mürciələrə, qədərilərə, zeydilərə, mötəzililərə yoxsa xaricilərə gedək?"..."[1510] Yenə eyni sualı verərək soruşmağımız lazımdır ki, imamların kimliyi əvvəlcədən bəlli olsaydı belə bir heyrətə, tərəddüdə və çaşqınlığa yer qalardımı? Hətta görünür ki, İmam Cəfər əs-Sadiq'dən əvvəl də eyni problem yaşanmışdı. əl-Kuleyni "əl-Kafi" kitabında isnadı ilə rəvayət edir ki, Əbu Ubeydə əl-Həzza deyib: "Biz İmam Əbu Cəfər – aleyhissəlam – vəfat etdikdən sonra çobansız qalmış qoyunlar kimi vurnuxurduq. Bu zaman bizə Səlim ibn Əbi Hafsə rast gəldi və mənə dedi: 'Ey Əbu Ubeydə, sənin imamın kimdir?' Mən cavab verdim: 'Mənim imamlarım Al-i Mühəmməddir.' Dedi: 'Sən həlak oldun və başqalarını da həlak etdin! Məgər sən və mən Əbu Cəfər'dən – aleyhissəlam – eşitmədik ki, belə buyurdu: "Kim imamı olmadan ölərsə, cahiliyyət ölümü ilə ölmüş olar?" Mən dedim: "Bəli, and olsun Allaha, elədir!" Hətta ondan üç gün əvvəl və ya ona yaxın bir vaxtda mən Əbu Abdullah'ın – aleyhissəlam – hüzuruna getmişdim, və Allah mənə maarifət nəsib etdi." Mən Əbu Abdullah'a – aleyhissəlam – dedim: "Səlim mənə belə və belə dedi." O buyurdu: "Ey Əbu Ubeydə, bizdən heç kəs özündən sonra onun kimi əməl edən, onun yolu ilə gedən və onun çağırdığı şeyə dəvət edən birisini öz yerinə qoymadan vəfat etməz."[1511] Bu rəvayətdən də aydın şəkildə anlaşılır ki, İmam

---

[1510] əl-Kuleyni, "əl-Kafi", 1/351; ət-Tusi, "İxtiyər Mərifətir-Ricəl", 2/199-200; Bunu Hişəm bin Səlim'dən rəvayət edən Əbu Yəhya əl-Vasiti məchuldur.

[1511] əl-Kuleyni, "əl-Kafi", 1/397; əl-Məclisi "Mirətul-Uqul" kitabında (4/298) isnadının həsən və ya muvassəq olduğunu yazır.

Muhəmməd əl-Baqir vəfat etdikdə şiələrin arasında eyni problem var idi, çünki Əbu Ubeydə qeyd edir ki, "çobansız qalmış qoyunlar kimi vurnuxurduq." Bu isə yalnız və yalnız o mənaya dəlalət edir ki, onlara yol göstərəcək, onlara doğruları başa salacaq bir imamları yox idi.

Maraqlı tərəf budur ki, on birinci imamdan sonra baş vermiş heyrət və böhran dövründən sonra şiə alimlərinin problemi radikal şəkildə dəyişməyə çalışdıqlarını görürük. Artıq dördüncü əsrdə şiələr arasında imamlar haqqındakı xəbərlər barəsində rahatsızlıq var idi. Şiə alimlərinin bu rahatsızlığı aradan qaldırmağa və boşluqları doldurmağa cəhd etdiklərini görmək mümkündür. Buna Şeyx əs-Saduq'un tələbəsi olmuş Əli bin Muhəmməd əl-Xazzəz əl-Qummi'nin misalını vermək olar. Ona nisbət olunan "Kifəyətul-Əsər" kitabında müəllif kitabın müqəddiməsində şiələrin arasında düşmüş bu heyrətdən və böhrandan danışır. "Şiələrin zəiflərindən və elmdə orta səviyyəli olanlardan bir qrupun bu məsələdə heyrət içində, aciz qaldıqlarını gördüm" deyən əl-Xazzəz qeyd edir ki, "onlar (imamlara) dəlalət edən naslar haqqındakı xəbərlərin heç kimsənin üzrü qaldıracaq yollarla gəlmədiyini iddia etdilər, bəziləri ifrata gedərək iddia etdi ki, bu barədə səhabədən bir əsər, itrətdən də bir xəbər yoxdur."[1512] Bu sözlər aşkar şəkildə ona dəlalət edir ki, bu dövrün şiə camiasını böhrana salan səbəb on iki imam haqqında etibarlı xəbərlərin olmaması idi. Əgər bu xəbərlər olsaydı hamıdan qabaq şiələrin xəbəri olardı. Bu problemi həll etmək məqsədi ilə kitab yazmış əl-Xazzəz özündən bir əsr əvvəl mövcud olmayan bir zənginlik ortaya qoymağa nail olub. Kitabında imamların saylarını və adlarını bir-bir qeyd edən bir-birindən fərqli xəbərləri müxtəlif isnadlarla səhabələrdən və onların tələbələrindən rəvayət edir. İbn Abbas'dan bu xəbəri Said bin Cubeyr, Mücahid, Tavus bin Keysan, Ata bin Əbi Rabəh kimi əhlüs-sünnətin böyük imamlarından rəvayət edir. Abdullah bin Məsud'dan bu xəbəri əs-Səib bin Malik, ondan isə oğlu Ata bin əs-Səib yolu ilə rəvayət edir. Əbu Said əl-Xudri'dən bu xəbəri Atiyyə əl-Avfi, Əbu Harun əl-Abdi kimi yalanda ittiham olunmuş şiə ravilər ilə yanaşı Said bin əl-Museyyəb kimi böyük alimdən, İyəs bin Sələmə, Əbus-Siddiq ən-Nəci kimi siqa ravilərdən hekayət edir. Əbu Zərr əl-Ğifəri'dən bunu yenə Said bin əl-Museyyəb vasitəsilə rəvayət edir. Bunu həmçinin Cabir bin Abdilləh'dən də rəvayət edir; bir isnadda bunu ondan rəvayət edən ravi yalanda ittiham edilmiş məşhur kufəli şiə ravi Cabir bin Yezid əl-Cufi'dir, digər isnadda isə bunu Şamın böyük

---

[1512] əl-Xazzəz, "Kifəyətul-Əsər fin-Nusus aləl-Əimməti əl-İsnə Aşər", səh: 61; Mərkəz Nurul-Ənvar, Qum, 1430

əhlüs-sünnət imamı Məkhul vasitəsilə səhabə Vasilə bin əl-Əsqa'dan, o da Cabir əl-Ənsari'dən rəvayət edir. Bir başqa isnadda Məkkənin tanınmış sünni imamı Sufyan bin Uyeynə vasitəsilə İmam Cəfər'dən, o atası Baqir'dən, o da Cabir əl-Ənsari'dən rəvayət edir, bir başqa yerdə Zeyd bin Həsən əl-Ənməti yolu ilə eyni mənada bir başqa rəvayəti İmam Cəfər kanalı ilə rəvayət edir. Eləcədə Rukeyn bin ər-Rabi yolu ilə əl-Qasim bin Həssən'dən, o da Cabir'dən rəvayət edir. Ənəs bin Malik'dən bunu nəvəsi Hişəm bin Zeyd, azadlı köləsi Ənəs bin Sirin rəvayət edir. Əbu Hureyra'dan bunu Said əl-Məqburi, Abdurrahmən əl-Arac, Əbu Məryəm rəvayət edir. Hətta bunu Ömər bin əl-Xattab'dan azadlı köləsi İsa bin Abdilləh bin Malik yolu ilə, Osman bin Affan'dan oğlu Amr, ondan da Said bin əl-Museyyəb rəvayət edir. Zeyd bin Sabit'dən bunu əl-Qasim bin Həssən, Amir bin Vasilə adı ilə rəvayət edir. Bu şəkildə Zeyd bin Ərqam, Əbu Umərnə, Vasilə bin əl-Əsqa, Əbu Əyyub əl-Ənsari, Ammar bin Yasir, Huzeyfə bin Useyd, İmran bin Huseyn, Sad bin Əbi Vaqqas, Huzeyfə bin əl-Yəmən, Əli bin Əbi Talib, Ummu Sələmə, Aişə və başqa səhabələrdən eyni mənada hədislərə yer verir. Bu hədislərin isnadlarında Sufyan əs-Səvri, əş-Şabi, Sufyan bin Uyeynə, Abdurrahmən bin Mehdi, İshaq bin Rahaveyh kimi sünnət əhlinin görkəmli alimlərinin adlarının keçməsi də diqqətə layiqdir. əl-Xazzəz, onun müasirləri və sonrakı təbəqələri təmsil edən şiə alimləri dünyada hər cür ravidən bu on iki imam xəbərini rəvayət ediblər; sünni, vaqifi, fətahi, zeydi, ismaili, hətta nasibi saydıqları ravilərdən bu xəbəri rəvayət ediblər. Kufəli, şamlı, hicazlı, yəmənli, misirli o qədər sayda ravidən bu xəbərləri rəvayət ediblər ki, ağıl sahibi insanın ağlında belə bir sual əmələ gəlir; deyəsən bu on iki imamla bağlı xəbərləri imamların ən yaxın tələbələri olduqları iddia olunan ravilərdən başqa hamı bilib! Həmin yaxın tələbələrə gəldikdə isə hər dəfə bir imam öldükdə ondan sonrakı imamın kim olmasında ixtilaf edərək parçalanıblar. Əlbəttə ki, İslam tarixindən və rəvayət elmindən bəlli miqdarda təsəvvürü olan kəs anlamalıdır ki, bu mətnlər və bu isnadlar uydurmadan başqa bir şey deyil. Heydər Əli Qələmdəran əl-Qummi haqlı olaraq bu barədə deyir: "Çox aydın bir məsələdir ki, bu hədisləri səhabələrə ona görə (uydurub) nisbət ediblər ki, qoy desinlər ki, "fəzilət düşmənlərin belə şahidlik etdiyindədir."[1513] əl-Xazzəz'in kitabında keçən xəbərləri uydurub, onları səhabələrə qədər çatan isnadlarla rəvayət etmək əməliyyatının məsuliyyətini kimin daşıdığını müəyyən etmək bizim kitabımızın mövzusu deyildir. Lakin qarşımızda danılmaz

[1513] Qələmdəran, "Tariqul-İttihəd", səh: 290;

bir reallıq vardır; imamların sayı və adları ilə bağlı yaranmış böhranı həll etmək üçün hədislər uydurulub.

Hicri 360-cı ildə vəfat etmiş şiə alimi İbn Əbi Zeynəb ən-Numəni "əl-Ğeybə" adlı kitabında imamların sayı ilə bağlı açdığı bölmədə fərqli rəvayətlər qeyd edir. Bu bölmənin sonunda bu barədə gəlmiş rəvayətlərin qədimliyini sübut etmək istəməsi onu göstərir ki, ən-Numəni də şiələrin arasında yayğın olan bu heyrəti aradan qaldırmağa çalışırdı.[1514] Bundan da maraqlı fakt budur ki, hicri 346-cı ildə vəfat etmiş tarixçi alim Əbul-Həsən əl-Məsudi yazır ki, on iki imamın olduğunu deyən şiə firqəsinin dəlili Süleym bin Qeys'in kitabıdır. Bu rəvayəti qısa şəkildə zikr etdikdən sonra əl-Məsudi yazır: "Bu xəbəri Süleym bin Qeys'dən başqa heç kim rəvayət etməyib."[1515] əl-Məsudi'nin (h. 283-346) şiə məzhəbinə mənsub[1516] bir alim, üstəlik bir tarixçi olduğunu vurğuladıqdan sonra onun bu məsələdə Süleym bin Qeys'in kitabındakı rəvayətdən xəbərsiz olmasına diqqət çəkməyimiz önəmlidir. Bu mövzudakı rəvayətlər iddia olunduğu kimi sabit və əsaslı idisə necə olur ki, əl-Məsudi kimi bir tarixçi alim bu barədə Süleymin kitabından başqa bir tarixi qaynağın olduğunu bilmir?! Halbuki o, Bağdadda dünyaya gəlmiş, fars, hind ərazilərini, Xəzər dənizinin ətrafını gəzmiş, Ərəb yarımadasının cənubundan Sudana, Şama və

---

[1514] ən-Numəni, "Kitəb əl-Ğeybə", səh: 103-104;

[1515] əl-Məsudi, "ət-Tənbih val-İşrəf", 1/199; Darus-Savi, Qahirə

[1516] Onun şiə məzhəbinə mənsub olması hətta imami şiələri tərəfindən də təsdiq olunur. ən-Nəcaşi onu ricəl kitabında (səh: 254, rəq: 665) gətirir. Həmçinin əs-Seyyid İbn Tavus (vəfatı h. 664) "Fəracul-Məhmum" kitabında (səh: 126) yazır: "Ulduzlar elmini bilməklə vəsf olunmuşlardan biri də şiə olan fəzilətli şeyx Əli bin əl-Hüseyn bin Əli əl-Məsudi'dir, "Muruc əz-Zəhəb" kitabının müəllifidir…" İbn İdris əl-Hilli (vəfatı h. 598) "əs-Sərair" kitabında (1/615) yazır: "Bu adam bizim əshabımızdan olan yazıçı alimlərdəndir, haqqa etiqad edəndir." İbn İdris'in bu sözləri əl-Məsudi'nin nəinki ümumən şiə olmasını, hətta xüsusilə imami şiəsi olmasını tələb edir. Üstəlik əş-Şəhid əs-Səni "əl-Xulasə" kitabına yazdığı haşiyədə İbnul-Mutahhər əl-Hilli'nin birinci qisimdə qeyd etdiyi ravilərə ya özlüyündəki zəifliyə görə, ya da məzhəbinə görə o qismə aid olmadığını düşündüyü üçün etirazlar edir, lakin əl-Məsudi haqqında hansısa bir etiraza yer vermir. Haşim əl-Bəhrani "Bəhcətun-Nəzar" kitabında (səh: 16) Əli bin Əbi Talibin imaməti haqqında danışarkən yazır: "Bu barədə qədim alimlərimiz, erkən dönəm fəzilətlilərimiz kitablar yazıblar" və sonra onların adlarını qeyd edir. Başlatdığı uzun siyahıda dördüncü yerdə əl-Məsudi və onun kitabını qeyd edir. Alləmə əl-Məclisi "Biharul-Ənvar" kitabında (44/310) yazır: "O, bizim imami alimlərimizdəndir." Bir digər şiə alimi Mirzə Abdullah Əfəndi əl-Əsbəhani "Riyadul-Uləmə" kitabında (3/428) yazır: "İmami əshabımızdan olan qədim şeyxdir, əs-Saduq'un müasiridir." Muhəmməd əl-Məzəndərani "Muntəhə əl-Məqal" kitabında (4/391) onunla bağlı yazır: "Bu əl-Məsudi imamiyyə alimlərinin ən böyüklərindən, on iki imam şiələrinin ən qədim fəzilət sahibi alimlərindəndir." Bütün bunları qeyd etməyimizdəki məqsəd, əl-Məsudi'nin on iki imam şiələrindən olduğunu və bununla belə on iki imam haqqındakı rəvayətlərdən xəbərsiz olduğunu göstərməkdir.

Rum torpaqlarına qədər böyük bir ərazini ziyarət etmiş və Misirdə Fustat şəhərində olmuşdur. Bu bölgələrdə qarşılaşdığı elm əhlindən bu barədə hansısa bir xəbəri eşitmiş olduğu halda ömrünün sonlarında yazdığı bir kitabda belə bir söz söyləməsi çox məntiqsiz gəlir. Burada məntiqli olan tək bir izah budur ki, əl-Məsudi'nin zamanında bu rəvayətlər hələ də ixtira edilmə, formalaşdırılma prosesində idi.

Belə görünür ki, o zaman şiələrin arasında bu məsələdə qarşıya qoyulan çalışmalar hər kəsi qane etmirdi. Çünki cavabsız qalmış suallar çox idi; əgər imamların sayı və adları məlum idisə nə üçün imamların sağ olduğu əsrlərdə yaşamış şiələr öz aralarında bu qədər ixtilaf ediblər?! Nə üçün onların bu rəvayətlərdən xəbərləri yox idi?! Sanki bu cavabsız sualların tələb etdiyi cavabları bəzi şiə ravilər hədislərin içərisinə daxil etməyə başladılar. Misal üçün bir hədisdə Cabir bin Abdilləh əl-Ənsari - radiyallahu anhu - peyğəmbərdən - salləllahu aleyhi va alə əlihi va sələm - ayədə keçən itaət olunması vacib əmr sahiblərinin kim olduğunu soruşur və peyğəmbər onların özündən sonra gələcək on iki xəlifə olduğunu xəbər verir, sonra onların adlarını qeyd edir, sonuncu imamın qeybətə çəkiləcəyini deyir. Hədisin axırında guya peyğəmbərimiz - aleyhissalətu vassələm - Cabirə deyib: "Ey Cabir! Bu Allahın sirrindən gizli olandır, elmindən qorunulandır, ona görə də onu gizlət və ona əhl olan kəslərdən başqasına xəbər vermə!"[1517] Bir başqa rəvayətdə Muhəmməd əl-Baqir öz övladlarını toplayır, onlarla birlikdə qardaşı Zeyd bin Əli də var idi. Sonra onlar üçün Əli bin Əbi Talib'in - kərraməllahu vachəhu - öz əli ilə, peyğəmbərin - aleyhissələm - imlası ilə yazdığı bir məktubu çıxarır. Məktubun içindən şiələrdə məşhur olan lövhə hədisini, yəni imamların sayını və adlarını bəyan edən həmin məşhur hədisi onlara oxuyur. Bu hədisin axırında bu sözlər keçir: "Bu, Allahın sirridir və Onun dinidir, mələklərinin dinidir. Ona görə də buna əhl olanlar və Allahın övliyaları istisna olmaqla bu xəbəri hər kəsdən qoru!"[1518] Beləliklə də bu və bu kimi rəvayətlərdəki məqsəd, şiələrə bu elmin üç əsr ərzində gizli qalmasını izah etmək olub. Belə çıxır ki, üç əsr ərzində Allaha xas olan bir sirrə layiq olan, ona əhl olan kəslər barmaqla sayılacaq qədər az olub, ona görə də imamların ən yaxın əshabına da gizli qalıb, lakin "xoşbəxtlikdən" üçüncü əsrin sonlarından başlayaraq şiə camaatlarının hamısı bu sirrə əhl olublar. Əlbəttə ki, buradakı ziddiyyəti görməmək mümkün deyildir. Əgər bu, peyğəmbərin Əli və Cabir kimi az sayda

---

[1517] əs-Saduq, "Kəməlud-Din va Təməm ən-Nimə", 1/281;

[1518] Eyni mənbə, 1/341;

səhabəyə əhd etdiyi bir sirr idisə necə olur ki, əl-Xazzəz əl-Qummi bunu müxtəlif sənədlər ilə iyirmi beş səhabədən rəvayət edir?! Peyğəmbər - aleyhissələm - bu xəbəri gizli saxlamağa təşviq edibsə və bu xəbər üç əsr ərzində gizli qalıbsa o zaman üçüncü əsrdən sonra birdən birə bu qədər rəvayətin ortaya çıxması aşkar bir ziddiyyətdir.

## Əhlul-Beyt içində imamət inancı

Keçmişə doğru bir az da hərəkət etsək, ey şiə qardaşım, görərik ki, ümumiyyətlə əhlul-beytin böyükləri bu imamlıq etiqadından xəbərsiz olublar. Misal üçün əl-Kəşşi isnadı ilə rəvayət edir ki, Əbu Cəfər Muhəmməd bin Əli əl-Əhval'dan soruşurlar: "Əbu Abdilləhin hüzurunda səninlə Zeyd bin Əlinin arasında nə söhbət olub? Dedi: "Zeyd bin Əli dedi: "Ey Muhəmməd bin Əli, mənə çatan xəbərə görə sən Muhəmmədin ailəsində itaət olunması fərz olan bir imamın olduğunu iddia edirsən." Dedim: "Bəli, doğrudur və sənin atan Əli bin əl-Hüseyn onlardan biri idi." Dedi: "Axı bu necə ola bilər? O, isti yemək tikəsini mənə verərkən onu əli ilə soyudar və sonra mənə yedirərdi; səncə yeməyin istiliyindən mənə ürək yandırırdı, amma cəhənnəmin istiliyindən mənə ürək yandırmadı?!" Ona dedim: "Sənə xəbər verdiyi halda sənin küfr etməyindən, beləliklə də həm onun şəfaət haqqından, həm də Allahın məşiətindən məhrum olmağından qorxurdu..."[1519] Bu məzmunda Əbu Cəfər əl-Əhval ilə zeydilərin imamı Zeyd bin Əli arasında keçmiş söhbət bir çox şiə qaynağında fərqli isnadlar ilə rəvayət olunub. Şiə alimi əl-Xoyi bu rəvayətlərin birinin isnadının mürsəl, bir başqasını zəif hesab etsə də, bəzilərinin isnad baxımından "güclü" olduğunu yazır.[1520] Bu kimi rəvayətlər onu göstərir ki, Zeyd bin Əli kimi əhlul-beyt böyükləri iddia olunan imam etiqadına sahib deyildilər; qabaqcadan müəyyən edilmiş və ya atanın vəsiyyəti ilə ötürülən imamlıq fikrini qəbul etmirdilər. İmam Həsən'in nəvəsi Abdullah bin əl-Həsən bin əl-Həsən Məkkədə ikən kufəli Əli bin Saleh bin Saleh bin

---

[1519] əl-Kəşşi, "Ricəl əl-Kəşşi", səh: 138-139; Muəssəsətul-Alə lil-Mətbuat, 1430

[1520] əl-Xoyi, "Mucəm Ricəl əl-Hədis", 8/367; Muəssəsə əl-İməm əl-Xuyi əl-İsləmiyyə

Həy'ə deyir: "Ey qardaşım oğlu, bu binanın – yəni Kəbənin – Rəbbinə and oldun ki, onların imam haqqında dedikləri batildir."[1521]

Tarix özü bunu təsdiqləyir, beləki əhlul-beytdən bir çox zat əlinə qılınc alaraq zalım hakimlərə qarşı çıxmış, ədaləti yer üzərində bərqərar etməyə cəhd göstərmiş və insanları özünə itaət etməyə çağırmışlar. Əgər onlar öz dövründə itaət olunması vacib olan imamın mövcudluğunu bilsəydilər və ya buna etiqad etsəydilər heç bir şəkildə özlərinə itaətə dəvət etməzdilər. Misal üçün Zeyd bin Əli hicri 122-ci ildə Kufə şəhərində əməvi xəlifəsi Hişəm bin Abdilməlikə qarşı üsyan edib və xəlifəlik məqamına iddia etmişdi. İmam əl-Baqir ilə qardaşı Zeyd arasında keçən bir söhbəti əl-Kuleyni bizə məchul bir isnadla xəbər verir və o rəvayətin bir hissəsi belədir: "Zeyd o anda (qardaşına) qəzəbləndi və dedi: 'İmam, evində oturub pərdələri çəkərək cihaddan çəkindirən şəxs deyil. Əksinə, bizim aramızda olan imam, öz camaatını qoruyan, Allah yolunda haqq cihadla mübarizə aparan, xalqını müdafiə edən və onların namusunu qoruyandır."[1522] Biz bu söhbətin yalan olduğunu, sonradan bəzi ravilər tərəfindən rekonstruksiya olunmuş bir hekayət olduğuna inansaq da deməliyik ki, bunu uyduranlar Zeyd bin Əli haqqında bilinən və məşhur olan təsəvvürdən[1523] çıxış edərək uydurublar. əş-Şəhristani də qeyd edir ki, İmam Əbu Cəfər əl-Baqir öz qardaşı ilə arasında keçən bir söhbətdə ona belə demişdi: "Sənin məzhəbinə görə atan imam deyildi, çünki heç vaxt üsyan etməmiş və üsyan etmək haqqında danışmamışdı."[1524] Həmçinin İmam əl-Həsən əl-Muctəba'nın nəvəsi ən-Nəfs əz-Zəkiyyə ləqəbi ilə tanınmış Muhəmməd bin Abdilləh hicri 145-ci ildə Mədinə şəhərində abbasi xəlifəsi Əbu Cəfər əl-Mənsura qarşı üsyan etmiş və öldürülmüşdür. Əbul-Fərəc əl-Əsbəhəni onunla bağlı yazır: "Onun ailəsi ona Mehdi deyirdi və onun rəvayətlərdə haqqında danışılan şəxs olduğuna inanırdılar. Əbu Talibin ailəsinin alimləri onun 'Təmiz Nəfs' (*ən-Nəfs*

---

[1521] əs-Səmmən, "əl-Muvafəqa beynə Əhlil-Beyti vas-Sahabə", səh: 52 (48)

[1522] əl-Məclisi, "Mirətul-Uqul", 4/114;

[1523] əl-Kəşşi və əl-Kuleyni kimi şiə ricəl və hədis alimlərinin rəvayət etdiklərindən anlaşılır ki, Zeyd bin Əli əhlul-beyt içində qabaqcadan müəyyən edilmiş imamların olduğunu bilmirdi. Çox maraqlıdır ki, əl-Xazzəz əl-Qummi "Kifəyətul-Əsər" kitabında Cabir bin Abdilləh əl-Ənsari'yə nisbət etdiyi rəvayətlərdən birini məhz Zeyd bin Əli'dən rəvayət edir. Bu rəvayətə görə atası İmam Zeynulabidin əslində Zeydə imamların adları ilə bağlı gəlmiş Cabirin hədisini xəbər vermişdi. Amma Zeydin Əbu Cəfər əl-Əhval ilə münaqişəsindən aydın olur ki, atasından belə bir şey eşitmədiyini deyirdi. Bu bir daha göstərir ki, əl-Xazzəz'in kitabındakı xəbərləri uyduranlar çox səriştəsiz və keyfiyyətsiz bir iş görüblər.

[1524] əş-Şəhristani, "əl-Miləl van-Nihəl", 1/156;

*əz-Zəkiyyə*) və 'Həccər əz-Zeyt' adlanan yerdə öldürüləcək şəxs olduğunu düşünürdülər. O, ailəsinin ən yaxşısı və Qur'anı bilmə, onu əzbərləmə, din haqqında fəhmi, cəsarəti, səxavəti, qüvvəsi və ona yaraşan bütün məsələlərdə zamanının ən biliklisi idi. Heç kəs onun Mehdi olduğuna şübhə etmirdi və bu inanc xalq arasında geniş yayıldı. Bütün Bəni Haşimdən, o cümlədən Əbu Talibin və Abbasın nəslindən olan kişilər ona beyət etdilər."[1525] Görünür ki, əhlul-beytin böyüklərindən olan ən-Nəfs əz-Zəkiyyə imamət etiqadından xəbərsiz idi. Hətta əl-Kuleyni rəvayət edir ki, ən-Nəfs əz-Zəkiyyə dəvətini izhar etdikdə, abbasi xəlifəsinə qarşı üsyan etdikdə hamıdan beyət tələb edir, hətta Cəfər əs-Sadiq'in də beyət etməsini istəyir. "O dedi: "Allaha and olsun ki, mənə ya könüllü, ya da məcburi beyət edəcəksən və bu beyətin üçün təriflənməyəcəksən" Lakin (Cəfər) şiddətli bir şəkildə imtina etdi…"[1526] Bu rəvayət isnad baxımından zəif olsa da tarixi bir həqiqəti təmsil edir, çünki məlumdur ki, ən-Nəfs əz-Zəkiyyə üsyan etdikdə əhlul-beyt böyük ölçüdə ona beyət etmişdilər. Hətta ona qoşulub onun yanında vuruşanların arasında Cəfər əs-Sadiq'in övladları da olub. əl-Əsbəhəni deyir: "Əli bin əl-Abbas əl-Məqani bizə xəbər verdi; Bəkkar bin Əhməd bin əl-Yəsa bizə xəbər verdi; dedi: əl-Həsən bin əl-Hüseyn mənə əl-Hüseyn bin Zeyd'dən belə rəvayət etdi: "Hüseyn'in oğullarından dörd nəfər Muhəmməd bin Abdilləh bin əl-Həsənə qoşuldu: Mən, qardaşım İsa və Cəfər bin Muhəmməd'in iki oğlu Musa və Abdullah idi."[1527] Əgər əhlul-beytin böyükləri imamət etiqadında olsaydılar nə üsyan edərdilər, nə də bu üsyanda iştirak edərdilər.[1528] ən-Nəfs əz-Zəkiyyə'nin doğma qardaşı İbrahim də Basra şəhərinə gedərək insanları qardaşı Muhəmmədə beyət etməyə dəvət edirdi. Muhəmməd ən-Nəfs əz-Zəkiyyə'nin şəhadətindən sonra qardaşı Yəhya imamət bayrağını qaldırdıqda - şiə rəvayətinə görə - Musa bin Cəfər əl-Kazım'a bir məktub göndərir: "Əmmə bəd: Əlbəttə hər kəsdən əvvəl özümə Allahdan qorxmağı tövsiyə edirəm və bunu sənə də tövsiyə edirəm, çünki bu, Allahın əvvəlkilərə vəsiyyəti olduğu kimi

---

[1525] əl-Əsbəhəni, "Məqatil ət-Talibiyyin", səh: 207;

[1526] əl-Kuleyni, "əl-Kəfi", 1/363;

[1527] əl-Əsbəhəni, "Məqatil ət-Talibiyyin", səh: 244 və 333;

[1528] Çox qəribədir ki, əl-Xazzəz'in kitabında on iki imamla bağlı rəvayətlərdən biri əl-Hüseyn bin Zeyd vasitəsilə gəlir, halbuki həm əl-Hüseyn bin Zeyd, həm də qardaşı İsa bin Zeyd vaxtında ən-Nəfs əz-Zəkiyyə'yə imam olaraq beyət ediblər, onun bayrağı altında vuruşublar. Onların on iki imam etiqadına sahib olduqları halda bunu etmələri imkansızdır. Bu sadəcə olaraq bir daha sübut edir ki, on iki imamla bağlı xəbərləri uyduran kimsələr sadəcə olaraq onların adlarından istifadə ediblər.

axırıncılara da verdiyi vəsiyyətdir. Allahın dinində, Ona itaətə təbliğdə Allah köməkçiləri yanıma gəlib mənə, sənin (bizə olan) sevginlə yanaşı (bizi) köməksiz buraxmağın barəsində xəbər verdilər. Mən, Muhəmmədin - salləllahu aleyhi va əlihi - ailəsindən hər kəsin razı olacağı bir kəsə beyət etməklə bağlı məşvərət etdim, amma bunu rədd etdin, sən əvvəl atan da bunu rədd etmişdi. Çoxdan haqqınız olmayanı iddia etdiniz və Allahın sizə vermədiyi şeylərə ümid bəslədiniz. Siz yoldan çıxdınız və başqalarını da azdırdınız. Mən səni, Allahın Özündən xəbərdar etdiyi şeylərdən xəbərdar edirəm."[1529] Bu məktubun cavabında Musa belə bir məktub yazır və əvvəlində deyir: "Sənin məktubun mənə çatdı, orada mənim, məndən əvvəl isə atamın iddia etdiyini yazırsan. Lakin belə bir iddianı məndən eşitməmisən. Bunu deyənlərin şahidlikləri yazılacaq və onlardan sorğu-sual olunacaq." Gördüyümüz kimi burada nə Yəhya bin Abdilləh, nə də əmisi oğlu Musa bin Cəfər ilahi təyinatlı imaməti təsdiq etmirlər. Əksinə görünən budur ki, Yəhya'nın qulağına çatmış xəbərlərə görə Cəfər əs-Sadiq və oğlu Musa belə iddiada olublar, amma Musa bunu yalanlayır. Həmçinin İmam Cəfər'in oğlu Muhəmməd hicri 200-cü ildə Məkkədə qiyam edir, Hicaz əhli ona beyət edirlər. Bu zaman xəlifə əl-Məmun onun yanına "qardaşı oğlu Əli bin Musa ər-Rida'nı göndərdi, lakin onun sözlərini dinləmədi və müharibə etməyə əzm etdi."[1530] Xəlifənin göndərdiyi hərbi əməliyyat nəticəsində əsir alınan Muhəmməd daha sonra xəlifənin yanına gətirilir və onu bağışlayır. Bütün bu imamlar necə olur ki, Əli bin Əbi Talibin nəslində itaət olunması fərz olan imamın olduğundan xəbərsiz idilər?! Bu barədə düşünmən lazımdır, ey şiə qardaşım. Həmçinin əl-Kuleyni "Usul əl-Kəfi" kitabında isnadı ilə rəvayət edir ki, Said əs-Səmmən dedi: "Əbu Abdilləh'in – aleyhissələm – yanında idim və bu zaman onun yanına zeydilərdən iki kişi daxil oldu və ona dedilər: "Sizin aranızda itaəti vacib olan bir imam varmı?" Dedi: "Xeyr." Dedilər: "Etibarlı kəslər bizə xəbər veriblər ki, sən bunun belə olduğuna fətva vermisən, təsdiqləmisən. Onların adlarını sənə deyək; fılankəs və fılankəs və onlar təqva əhlidir, ciddi insanlardır, yalan danışanlardan deyillər." Əbu Abdilləh – aleyhissələm – qəzəbləndi və dedi: "Mən onlara belə bir şey buyurmamışam." Onlar onun üzündəki qəzəbi gördüklərində onun yanından çıxdılar..."[1531] Həmçinin əl-Kəşşi isnadı ilə rəvayət edir ki, İmam Cəfər'in yanında Əbul-Xattabın

---

[1529] əl-Kuleyni, "əl-Kəfi", 1/366-367;

[1530] əl-Əsbəhəni, "Məqatil ət-Talibiyyin", səh: 440;

[1531] əl-Kuleyni, "əl-Kəfi", 1/138; Mənşurat əl-Fəcr, 1428;

əshabından Cəfər bin Vaqid və bir qrup insanın adı zikr olundu və onun (yəni Əbul-Xattabın) Nemruda[1532] getdiyi və onların arasında belə dediyi deyildi: "Göydə də, yerdə də ilah odur!" [43:84] Dedi: "Yəni imam odur!" Əbu Abdilləh dedi: "Xeyr, Allaha and olsun ki, onunla əsla eyni evin çatısı altında sığınmaram! Onlar yəhudilərdən də, xristianlardan da, məcusilərdən də, şərik qoşanlardan da daha şərlidirlər. Allaha and olsun ki, heç bir şey heç zaman onlar qədər Allahın əzəmətini bu qədər kiçiltməmişdi. Həqiqətən də yəhudilərin dedikləri söz Üzeyrin qəlbində rahatsızlığa səbəb oldu, buna görə də Allah onun adını peyğəmbərlikdən çıxardı! Allaha and olsun ki, İsa əgər xristianların dediklərini təsdiqləsə Allah onu Qiyamət gününə qədər kar edər! Allaha and olsun ki, Kufə əhlinin mənim haqqımda dediklərini təsdiqləsəm Yer üzü məni udar. Mən, məmlük bir kölədən başqa birisi deyiləm, heç bir şeyə nə zərər, nə də fayda verməyə qadirəm!" Bu rəvayətdən sonra daha bir isnadla qeyd edir ki, "Qasim əs-Sayrafi dedi: "Əbu Abdilləhi – aleyhissələm – belə deyərkən eşitdim: "Bir qövm var ki, mənim onların imamı olduğumu iddia edirlər. Allaha and olsun ki, mən onlar üçün imam deyiləm. Onlara – Allah onlara lənət etsin! – nə olur ki, hər dəfə bir şeyi örtdüyümdə onu açırlar, Allah onların örtülərini açsın!.."[1533] Ey şiə qardaşım, Allah sənə doğru olanı göstərsin! Bu sözlərə diqqət etmən lazımdır və yaxından incələyərək düşünmən lazımdır! İmam Cəfər əs-Sadiq israrla imam olduğunu inkar edirdi, həmçinin təkrar-təkrar deyirdi ki, o, sıradan bir bəşərdir, "məmlük bir quldur", heç kəsə fayda və ya zərər verməyə qadir deyildir. Unutmayaq ki, Cəfər əs-Sadiq, atası Muhəmməd əl-Baqir, babası Əli Zeynulabidin hamılıqla Mədinə şəhərində yaşayıblar və Mədinə əhli olublar; Mədinə əhli isə sünnət etiqadına möhkəm sarılmış kəslər idilər. Onların adından imamlıq iddialarını yayanlar isə Kufə şəhərindəki şiələr olublar. Əgər bu iki mübarək zatdan imamlıq iddiaları sabit olsaydı Mədinə əhli onları - ən azından - bidətdə ittiham edərdilər, amma Mədinə əhli onları heç cür ittiham etməyiblər, əksinə seviblər və onları da sünnət imamları olaraq qəbul ediblər. Bu onu göstərir ki, Mədinə əhli nə Muhəmməddən, nə də Cəfərdən, nə də Əli bin əl-Hüseyn'dən belə bir iddia eşitməyiblər. Əbu Nueym səhih isnadla rəvayət edir ki, Əli bin əl-Hüseyn deyib: "Ey İraq əhli! Ey Kufə əhli! Bizi İslam sevgisi ilə sevin və bizi layiq olduğumuzdan yuxarı qaldırmayın!"[1534] İbn Sad'ın

[1532] Bəzi nüsxələrdə yerin adı "Beyruz" olaraq keçir.

[1533] ət-Tusi, "İxtiyar Mərifətir-Ricəl", 2/228-229; Muəssəsətus-Sadiq, 1440

[1534] Əbu Nueym, "Hilyətul-Əvliyə", 3/137;

bir başqa isnadla rəvayətində isə deyir: "Ey insanlar! Bizi İslam sevgisi ilə sevin! Bizə olan sevginiz həddini o dərəcədə aşdı ki, artıq sizin sevginiz bizim üçün utanc oldu."[1535] Şiə alimləri ümumilikdə yuxarıdakı rəvayətləri ya təqiyyə ilə, ya da ikibaşlı danışıq üslubu ilə izah edirlər. Lakin sən, ey şiə qardaşım, düşün ki, bu gün şiə məzhəbi öyrədir ki, imamlıq etiqadı şiə məzhəbinin zərurətlərindəndir və onu təsdiqləməyən kafirdir, əbədi cəhənnəmlikdir və necə olur ki, bu qədər zəruri olan etiqadi bir əsası, Yer üzündəki Allahın hüccəti olan imamlar gizlində, yalnız özlərinin "xas tələbələrinə" təbliğ edirdilər və yerdə qalan müsəlmanları bu "xeyirdən", bu zəruri biliklərdən məhrum edirdilər?! Bunun üzərində yaxşı-yaxşı düşün! Necə olur ki, bir tərəfdə şiə alimləri imamlığı sübut etmək üçün Yer üzünün Allahın hüccətindən xali olmayacağını əsas gətirirlər, digər tərəfdən isə həmin hüccətin təbliğatının həddindən artıq gizli və məhdud şəkildə getdiyini, təqiyyə və aldatmaq məzmununda baş verdiyini iddia edirlər? Məgər Allahın mərhəmətinə tək şayan olan Onun hüccətinin insanlar üçün aşkar olması deyilmi?!

Eyni şeyi Həsən və Hüseynin zamanında yaşayan şiələr üçün də demək olardı. Biz bilirik ki, onlar Həsən və Hüseynin məsum imamlar olduqlarına inanmırdılar. İmam Həsən öz zamanında xəlifəlik məqamından enib Müaviyə ilə sülh bağladığında şiələr onun bu hərəkətinə etiraz edirdilər. Əli bin Muhəmməd ət-Tabətabəi (vəfatı h. 1231) yazır ki, Hüseynin "şəhid olması ilə qəti şəkildə Allahın dininin yenidən dirilməsində şəkk yoxdur, çünki şiələr onun qardaşı Həsənin Müaviyə ilə sülh bağlamasına etiraz edirdilər və əgər Hüseyn də (onun kimi) sülh bağlasaydı şiələrin hamısı fəsada uğrayardılar, sünnilərin məzhəbi isə güclənərdi..."[1536] Əgər ilk şiələr Həsənin məsum bir imam olduğuna, xətadan qorunulmuş biri olduğuna inansaydılar o zaman nə üçün etiraz edirdilər?! ət-Tabətabəi başqa cür desək ilk şiələrin imamların xəta edə biləcəyinə inandıqlarını təsdiqləyir və onun sözündən anlaşılır ki, onların məsum olduqlarına inanmırdılar. İbn Əbi Şeybə səhih isnadla Əbul-Ğarif Ubeydullah bin Xəlifə'nin belə dediyini yazır: "Biz Məskin'də əl-Həsən bin Əli'nin avanqard ordusunda on iki min nəfər idik; Şam əhli ilə vuruşmaq üçün qılınclarımızdan axan əzm ilə özümüzü ölümə hazırlamışdıq. Ordumuzun başında Əbu əl-Amərrata (Umeyr bin Yezid əl-Kindi) durmuşdu." (Əbul-Ğarif) dedi: "əl-

[1535] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 5/214; Dar Sadir

[1536] ət-Tabətabəi, "Riyədul-Məsəil fi Təhqiq əl-Əhkəm vad-Dələil", 8/64; Muəssəsətu Al əl-Beyt, Beyrut

Həsən bin Əli'nin Müaviyə ilə sülh etməsi xəbəri bizə gəlib çatdıqda kədər və qəzəbdən sanki bellərimiz qırıldı. əl-Həsən bin Əli Kufəyə gəldikdə içimizdən Əbu Amir kunyəli bir nəfər qalxdı və dedi: "Sənə salam olsun, ey möminləri zəlil edən!" (əl-Həsən) dedi: "Belə demə, ey Əbu Amir! Mən sadəcə olaraq səltənət uğrunda onları öldürməyi xoş görmədim."[1537] əl-Bələzuri isə qeyd edir ki, İmam əl-Həsən'i bu sülhə görə qınayanlar arasında Hucr bin Adiyy də var idi və o İmam Həsənə "möminlərin üzünü qara etdin" dediyində Həsənin cavabı belə olmuşdu: "Hər kəs sənin sevdiyini sevmir, hər kəsin rəyi sənin rəyin deyildir. Nə etdimsə sizi qorumaq üçün etdim!"[1538] Həmçinin İbn Şəvzəb'in belə dediyi səhih sənədlə sabitdir ki, Həsən ilə Müaviyə sülh bağladıqdan sonra "əl-Həsənin əshabı ona belə deyərdi: "Yə Ar əl-Muminin!" O isə onlara belə cavab verərdi: "Ar atəşdən daha xeyirlidir."[1539] Əmirul-Muminin adı yerinə təhqir olaraq "ar əl-muminin", yəni "möminlərin utancı" və ya "möminlərin üzqarası" deməkləri Həsənin bu addımını şiddətli şəkildə inkar etməklərinə dəlalət edir. Birinci xəbərdə adı keçən Əbu Amir şiə ricəl kitablarında Sufyan bin Leyla əl-Həmədəni və ya Sufyan bin Əbi Leyla olaraq tanınır. əl-Kəşşi isnadı ilə İmam Əbu Cəfər'in belə dediyini rəvayət edir: "Həsən'in - aleyhissələm - əshabından Sufyan bin Leyla adlı bir nəfər minik üzərində ikən gəldi və Həsən bu zaman evinin bağında muhtəbi[1540] idi. (Sufyan) ona dedi: "Sənə salam olsun, ey möminləri zəlil edən!"..."[1541] Daha sonra rəvayətin tamamını zikr edir. Seyyid Muhsin əl-Əmin "Ayənuş-Şiə" kitabında sözü gedən bu Sufyan haqqında deyir: "Onun etibarlı və dəyəri yüksək biri olmasını göstərmək üçün onun İmam Həsənin həvarilərindən olduğuna işarə etmək kifayət edir."[1542] Maraqlıdır ki, İmam Həsənin həvarisi adlana biləcək belə bir şəxs hansı etiqada əsasən İmamı bu cür təhqir edici vəsflə çağırır?! Şiə alimi İbnut-Tavus buna izah gətirməyə çalışır və

---

[1537] İbn Əbi Şeybə, "əl-Musannəf", 21/279 əş-Şəsəri təhqiqi; Həmçinin əl-Fəsəvi "əl-Mərifə vat-Tərix" kitabında (3/317) eyni isnadla rəvayət edir. Bu xəbəri əl-Bəğavi "Mucəmus-Səhabə" kitabında (5/372) və əl-Uqeyli "əd-Duafə əl-Kəbir"də (2/175) Əbu Amir Sufyan bin Leyl'in özündən zəif sənəd ilə rəvayət edir.

[1538] əl-Bələzuri, "Ənsəb əl-Əşraf", 3/289;

[1539] İbn Abdilbərr, "əl-İstiyəb fi Mərifətil-Əshəb", 8/47; İbn Asəkir, "Tərix Diməşq", 13/261; İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 8/47;

[1540] Muhtəbi xüsusi bir formada oturana deyirlər və bu oturuşun adı ihtiba olaraq bilinir. Ərəblər dizlərini yığaraq əmmamələri ilə dizlərini bellərinə bağlamağa və bu şəkildə oturuşa ihtiba deyirlər.

[1541] "İxtiyər Mərifətir-Ricəl əl-Məruf bi Ricəl əl-Kəşşi", 1/328;

[1542] Muhsin əl-Əmin, "Ayən əş-Şiə", 7/263;

deyir: “Mənə aydın olan budur ki, o bu sözünü (Həsəni) sevdiyindən deyib və Həsən - aleyhissələm - dedi: “Bizi sevmək, rüzgar ağacdan yarpaqları tökdüyü kimi insanın da günahlarını aparır.”[1543] Belə anlaşılır ki, İbn Tavus bu əməlin günah olduğunu etiraf edir. Lakin bu cür sözləri imamın məsumluğuna etiqad etməklə necə bir araya gətirmək mümkündür?! Şübhəsiz ki, İmam Həsənin əshabı onun məsum olduğuna inanmırdılar. əş-Şərif əl-Murtəda “Tənzihul-Ənbiyə” kitabında təsdiq edir ki, onun şiələri “onu “möminləri zəlil edən” adlandırdılar və üzünə durub onu azarlayırdılar.” Həmçinin bu məzmunda deyir: “Hucr bin Adiy əl-Kindi ona - aleyhissələm - “möminlərin üzünü qara etdin” dedikdə belə cavab verdi: “Hər kəs sənin istədiyini istəmir, hər kəs sənin rəyində deyildir. Nə etdimsə sizin sağ qalmağınız xatirinə etdim.”[1544] Bu və digər tarixi şahidliklər işığında deyə bilərik ki, ilk şiələrin etiqadında məsumiyyət inancı olmayıb. Hucr bin Adiy sıradan bir kimsə deyildi; əksinə Əli bin Əbi Talibin yanında vuruşmuş, ona yaxın bir silahdaş olmuş bir kimsə idi. Atasından sonra oğullarının müdafiəsində davam etmişdi. Əgər belə bir kimsə imamət inancından cahil olubsa başqa kimin bunu bilməsi mümkün idi?!

İmam Əli - kərraməllahu vachəhu - özünün məsum olduğuna inanmırdı və insanlara da özünün məsum olduğunu öyrətmirdi. Əksinə insanlara xitabında hər zaman onlara xatırladırdı ki, heç kimə mütləq itaət yoxdur, hətta özü belə xəta etdiyi təqdirdə ona itaət edilməməsini əmr edirdi. “Nəhcul-Bələğa” kitabında xaricilərə yazdığı məktubunda deyir: “Təfriqədən və parçalanmadan uzaq durun, çünki insanlardan uzaqlaşan şeytanın qurbanı olur, necə ki, sürüdən ayrılan qoyun qurda qurban olur. Bilin ki, kim sizi bu şüara çağırırsa, onu öldürün, hətta o, bu sarığımın altında olsa belə!”[1545] Qısacası İmam Əli deyir ki, hətta mən belə sizi parçalanmağa, təfriqəyə çağırsam məni öldürün! Əgər Əli məsum olduğuna inansaydı onun insanlara öyrətməsi vacib olan şey mütləq itaət olmalı idi; yəni “ey insanlar, mən Allahın təyin etdiyi məsum imamam, sizə bir şey əmr etdiyimdə eşidin və itaət edin, çünki mən sizə xəta olan bir şey əmr etmərəm.” Bunu demək əvəzinə Əli - kərraməllahu vachəhu - insanlara özünün xəta etdiyi təqdirdə itaət etməməklərini öyrədir. Eyni vəziyyəti biz Əlinin və Hüseynin nəvələri arasında da müşahidə edirik. Şeyxut-Taifə ət-Tusi və başqaları Zurara’nın belə dediyini rəvayət edirlər: “Mən Əbu Cəfərin -

---

[1543] “ət-Təhrir ət-Tavusi”, səh: 145;

[1544] “Tənzihul-Ənbiyə”, səh: 221-223;

[1545] ər-Radi, “Nəhcul-Bələğa”, 2/8;

aleyhissələm - yanında oturmuşdum və orada yalnız onun oğlu Cəfər - aleyhissələm - var idi. Əbu Cəfər dedi: 'Ey Zurara, Əbu Zərr və Osmanın Rəsulullahın - salləllahu aleyhi va əlihi - dövründə mübahisəsi oldu. Osman dedi: Qızıldan və gümüşdən olan hər hansı bir sərvət ki, ticarət üçün dövriyyədədir və işlədilir, bir il keçdikdən sonra ona zəkat düşür. Lakin Əbu Zərr dedi: Ticarətə verilən və ya dövriyyədə olan sərvətə zəkat düşmür; zəkat yalnız torpağa basdırılmış və ya yığılmış sərvətə düşür, və bir il keçdikdən sonra ona zəkat vacib olur.' Beləliklə, onlar bu məsələni Rəsulullahın - salləllahu aleyhi va əlihi - yanına gətirdilər və O dedi: 'Əbu Zərrin dediyi doğrudur.' Cəfər - aleyhissələm - sonra atasına dedi: 'Sənin bununla məqsədin nədir axı?! Bu dediyinə görə insanlar kasıblarına və möhtaclarına rəhm etməsinlər?!' Atası isə cavab verdi: 'Məni rahat burax, bunun başqa bir yolu yoxdur.'"[1546] Bu rəvayətin səhih olduğunu[1547] qeyd edən əl-Məclisi belə bir şərh verir: "Görünür ki, onların - salavatullahi aleyhimə - mübahisəsi sadəcə sünni camaatı susdurmaq üçün idi ki, oğlu atası ilə mübahisə etdi, atasının sözlərini qəbul etmədi desinlər, çünki o, yalnız öz əcdadlarından, onların Rəsulullahdan - salləllahu aleyhi va əlihi va səlləm - və onun da Allahdan nəql etdiklərini söyləyir."[1548] əl-Məclisi'nin bu izahı çox qəribədir, çünki Zurara özü deyir ki, həmin məclisdə Muhəmməd əl-Baqir və oğlu Cəfər'dən - radiyallahu anhumə - başqa heç kim yox idi, o zaman görəsən Cəfər əs-Sadiq atasına etiraz edərkən bununla sünniləri necə susdurmağı düşünürdü?! Əlbəttə ki, belə bir şərh rəvayətdən aşkar şəkildə anlaşılan mənaya zidd bir şərhdir. Aydın olan budur ki, Cəfər əs-Sadiq atası Muhəmməd əl-Baqir'in fətvası ilə razılaşmır. Ona görə də əl-Vahid əl-Bəhbəhəni bir az daha aydın şəkildə yazaraq deyir: "Bunun dəlalət etdiyi məna budur ki, bu iki məsum arasında baş verən hadisə onların məsumluğuna yaraşmayan bir şey idi. Beləliklə də görünür ki, bu, nurə kisəsi babındandır ki, atası ilə o tərzdə danışıb, atasının cavabı da belədir. Burada Zurara'nın yalnış anlamış olması ehtimalı da var."[1549] Burada ən aşkar olan ehtimal budur ki, Cəfər əs-Sadiq və atası Muhəmməd əl-Baqir ictihad əhli olan elm əhli idi və məsələdə fərqli fikirlərə sahib olublar; Cəfər əs-Sadiq atasının məsum olduğuna inanmayıb, xəta etmiş ola biləcəyini çox

---

[1546] ət-Tusi, "əl-İstibsar", 2/9; ət-Tusi, "Təhzibul-Əhkəm", 4/70;

[1547] Bunu həmçinin Muhəmməd Asif əl-Muhsini "Mucəm əl-Əhədis əl-Mutəbəra" kitabında (1/99) səhih elan edir.

[1548] əl-Məclisi, "Ravdatul-Muttəqin fi Şərh Mən Lə Yəhduruhu əl-Fəqih", 3/44;

[1549] əl-Bəhbəhəni, "Məsabih əz-Zaləm fi Şərh Məfətih əş-Şərai", 10/107;

gözəl bilirdi və buna görə də həmin məqamda arası ilə razılaşmamış olması çox normal bir haldır.

Musa əl-Kazım'ın tələbələrindən olan İmam əl-Qasim bin İbrahim ər-Rassi əhlul-beytin imami şiələrinin etiqad etdikləri etiqadda olmadığını göstərmək üçün deyir: "Rafizilərə deyilər: Allahın elçisinin əhli-beyti haqqında - salləllahu aleyhi va əlihi- bizə xəbər verin; onlar müşrik idilər yoxsa kafir yoxsa müsəlman idilər? Əgər onların müsəlman olduqlarını iddia etsəniz deyərik: Allahın elçisinin əhli beyti, onların alimləri - salləllahu aleyhi va aleyhim - icma ediblər ki, siz İslam yolu üzərində deyilsiz. Əgər əhli-beytin haqqı bildiklərini, lakin həsəd sahibi olduqları üçün inkar etdiklərini iddia etsələr deyilər: Biz əhli-beytin halından şahid olduğumuz budur ki, onların yanında bir kimsənin fəziləti, zühdü və elmi aydın olduqda ona tabe olurlar, onun fəzilətini təsdiqləyirlər, onun hökmünə razılaşırlar, bəs necə olur ki, başqalarına yox məhz sizin sahibinizə həsəd edirlər?! Əgər sizin dediyiniz kimi haqqı təsdiq etməklərinə mane olan tək səbəb həsəd olsaydı o zaman heç kimsənin haqqını təsdiqləməzdilər, onlardan hər biri özünə dəvət edərdi, yoldaşının fəzilətini təsdiqləməzdi. Lakin siz onların adından yalan danışırsız, çünki biz onların sözünü Allahın Kitabının təsdiqlədiyini, sizin sözünüzü isə Allahın kitabının yalanladığını görürük. Onlar sizdən daha çox sidq adına layiqdirlər, çünki biz onlarda olan zühdün başqalarında olmadığını görürük. Onlar əhli beyti sizdən daha yaxşı tanıyırlar. Ey batil iddia sahibi! Onlar bir-birilərini səndən daha yaxşı tanıyırlar. Sən isə istəyirsən ki, sənin batil iddianı heç bir bəyan və burhan olmadan qəbul edək və peyğəmbərin - salləllahu aleyhi va əlihi - əhli-beytini yalanlayaq!! Madam ki, sahibinizin hüccət olduğunu iddia edirsiz, o zaman ona yaraşan Allahın elçisinə - salləllahu aleyhi va əlihi va səlləm - tabe olmaq, onun felini nümunə götürmək deyilmi?! Allah - təbərakə va təalə - buyurur: "Həqiqətən, Allah Rəsulunda Allaha və axirət gününə ümid bəsləyib Allahı çox zikr edən sizlər üçün gözəl bir örnək vardır." [33:21] Məgər sizin sahibinizin sıradan insanlara nəsihət göstərmədən əvvəl öz əhli-beytinə nəsihət etməsi daha doğru deyilmi? Necəki Allahu təalə ona əmr etmiş və demişdir: "Ən yaxın qohumlarını xəbərdar et!" [26:214] Beləliklə də Allahın elçisi - salləllahu aleyhi va əlihi va səlləm - Abdulmuttalib və Abdu Mənaf oğullarından qırx nəfəri, Bənu Məxzumdan bir çox kişini çağırdı; aralarında Əbu Cəhl bin Hişəm, əl-Valiq bin əl-Muğira da var idi və o qövmün arasında Əbu Bəkr də, Umeyyə oğullarından Osman, Saxr bin Hərb Əbu Sufyan da var idi.

Bununla da ona enmiş vəhydən bildikləri ilə onları xəbərdar etdi, Allahın ona vəhy etdiklərini onlara xəbər verdi, onlara nəsihətini çatdırdı, onları ona dəstək göstərməyə çağırdı. Aralarında buna icabət edənlər olduğu kimi müxalif olanlar da oldu. Onların təkzib etməklərindən, inkar etməklərindən, kənarda qalmaqlarından qorxmadı. Həm ona tabe olanlara, həm də ona asi olanlara hüccət idi. Ona görə də Allahın elçisi - salləllahu aleyhi va əlihi - öz qohumlarına bəyan etdiyi kimi sizin sahibinizə də öz əhli-beytinə bəyan etmək vacib deyilmi?! Əgər desələr ki, (sahibləri) onların onu qəbul etməməklərindən, onu yalanlamaqlarından və ona həsəd etməklərindən qorxur, (buna cavab olaraq) deyilər: Sizi görüm həlak olasız! Allahın elçisinin - salləllahu aleyhi va əlihi - ev əhlinə qarşı atdığınız bu iftira nə qədər də ağırdır! Məgər sizə görə onların Allahın elçisinin təbliğ etdiyi qureyşlilərdən daha şərlidirmi?!" Daha sonra ər-Rassi əhlul-beytin böyüklərinin adlarını bir-bir sayır. Onların arasında Zeyd bin Əli, qardaşı Ömər və Əlini, Hüseyn bin Əli bin Həsəni, İmam əl-Həsən'in oğlu əl-Həsən əl-Musənna'nı, iki oğlu Abdullah əl-Kamil'i və əl-Həsən əl-Musəlləsi, axırıncının oğlu abidlərin seyyidi Əli bin əl-Həsən'i, sonra onun oğlu əl-Hüseyn bin Əli'nin adını çəkir, bura ən-Nəfsuz-Zəkiyyə ləqəbli Muhəmməd bin Abdilləh əl-Kamil'i, qardaşları İbrahim bin Abdilləh əl-Kamil'i, Yəhya, İdris, Süleyman, Cəfər və Musa bin Abdilləh əl-Kamil'i, sonra Zeyd bin Əli'nin oğulları Yəhya, İsa, Muhəmməd və əl-Hüseyn'i və başqalarını əlavə edir. Onların insanların ən zahidləri, ən xeyirliləri olduqlarını bəyan etdikdən sonra deyir: "Sizcə bunların hamısı və onların əhli-beytinin hamısı haqdan ən cahil olanlar, həsədi ən şiddətli olanlar, bağilikləri ən şiddətli olanlar idilər?!"[1550]

## İlk şiələr və səhabələr

Zamanda səyahətimizə davam edib bir qədər də keçmişə getsək görərik ki, ilk şiələr ümumiyyətlə müasir şiə məzhəblərindən tamamilə uzaq olublar. Misal üçün sünni tarix qaynaqlarına nəzər

[1550] ər-Rassi, "Məcmu Kutub va Rasəil əl-İmam əl-Qasim bin İbrahim ər-Rassi", səh: 564-573; Dar əl-Hikmətil-Yəməniyyə, Sana, 2001

saldığımızda görürsən ki, onlar ilk şiələr haqqında məlumat verərkən onların necə olduqlarını da qeyd edirlər. İmam Yəhya bin Main deyir: “əl-Mubərak bin Said bizə Əbul-Cəhhəf’in belə dediyini rəvayət etdi: “İlk şiələri gördüm və onların arasında aşırı olanları Əlini Əbu Bəkr və Ömər’dən üstün sayanlar idi.”[1551] Sözü gedən Əbul-Cəhhəf kufəli şiələrdən sayılan Davud bin Əbi Auf ət-Təmimidir. əl-Laləkayi isnadı ilə rəvayət edir ki, Leys bin Əbi Suleym dedi: “Kufədəki ilk şiələrlə qarşılaşdım və onlar heç kimi Əbu Bəkr və Ömərdən üstün tutmurdular.”[1552] Onu da qeyd edək ki, İbn Əbi Suleym zaman baxımından təxminən Cəfər əs-Sadiq ilə eyni zamanda yaşayıb. Həmçinin İbn Batta isnadı ilə rəvayət edir ki, Hudeyr bin Kureyb dedi: “Əbu İshaq əs-Səbii Kufəyə gəldi və Şimr bin Atiyyə bizə dedi: “Onun yanına gedin!” Biz onun yanında oturduq və onlar danışdılar; Əbu İshaq dedi: “Mən Kufəni tərk etdiyimdə Əbu Bəkrin və Ömərin fəzilətində, onların başqalarından üstünlüyündə şəkk edən yox idi, indi isə gəlmişəm və onlar deyirlər və deyirlər, Allaha and olsun ki, nə dediklərini anlamıram.”[1553] Yenə əl-Laləkayi isnadı ilə rəvayət edir ki, Sələmə bin Kuheyl dedi: “Mən iyirmi il bu məsciddə əl-Museyyəb bin Nəcbə əl-Fizəri ilə və şiələrdən çox sayda insan ilə oturub durdum; onlardan heç birini Allahın elçisinin – salləllahu aleyhi va səlləm – səhabələri haqqında xeyirdən başqa bir şey deyərkən eşitmədim.”[1554] Əbu Yusuf əl-Fəsəvi isnadı ilə rəvayət edir ki, əl-Aməş dedi: “Mən heç zaman gözləməzdim ki, onların Əlini Əbu Bəkr və Ömərdən üstün tutacaqları bir zamanda yaşayacam.”[1555] Ola bilsin ki, ey şiə qardaşım, bu rəvayətlərin və xəbərlərin sünni qaynaqlardan gəldiyini görüb təsdiqləmək istəmirsən. Lakin özün düşün ki, sünni qaynaqlarında bu qədər erkən şahidliklər nə üçün yalan olsun ki?! Üstəlik nəzərə alman lazımdır ki, bu xəbərlərdə deyilənləri hətta şiə alimləri özləri də təsdiq edirlər. əş-Şərif əl-Murtəda deyir: “Məlumdur ki, Əlinin – aleyhissələm - əshabının əksəriyyəti ondan əvvəlki xəlifələrin imamlığına etiqad edirdilər və onların arasında o xəlifələri bütün ümmətdən daha üstün hesab edənlər var idi.”[1556] Əslində əl-Murtəda bu sözləri ilə sünni

---

[1551] İbn Mihraz, “Mərifətur-Ricəl”, səh: 254; əl-Fəruq əl-Hədisə, 1430

[1552] əl-Laləkayi, “Şərh Usul İtiqad Əhlis-Sunnə val-Cəmaa”, 4/139; əl-Məktəbə əl-İsləmiyyə, 1425

[1553] İbn Teymiyyə, “Minhəc əs-Sunnə ən-Nəbəviyyə”, 6/135-136; Raşid Səlim, 1406

[1554] əl-Laləkayi, “Şərh Usul İtiqad Əhlis-Sunnə val-Cəmaa”, 4/230; əl-Məktəbə əl-İsləmiyyə, 1425

[1555] əl-Fəsəvi, “əl-Mərifə vat-Tarix”, 2/764; Mətbəətul-İrşad, Bağdad, 1974

[1556] əl-Murtəda, “əş-Şəfi fil-İməmə”, 3/114; Muəssəsətu əs-Sadiq, 1429

mənbələrdə keçən xəbərlərin doğruluğunu təsdiqləmiş olur. Həmçinin Hüseyn ən-Nuri ət-Tabərsi yazır: "Buradan bilinir ki, möminlərin əmiri (Əli) – aleyhissələm – ilə birlikdə üç döyüşdə vuruşub öldürülənlər şəhiddirlər və onların arasında o ikisini təvəlli edən çox nəfər var idi."[1557] O ikisini təvəlli etmək ilə qəsd etdiyi budur ki, Əbu Bəkr və Öməri sevənlər, onların Allah dostları olduqlarına etiqad edənlər çox idi. Eləcədə Həsən bin Əli əl-Kərki əl-Amili yazır: "Əli ilə yanaşı bu müharibələrdə iştirak edənlər - az qismi istisna - ondan əvvəlki xəlifələrin imamətinə etiqad edirdilər."[1558]

İlk iki xəlifənin fəzilətini və haqqını etiraf edənlərin başında möminlərin əmiri Əli bin Əbi Talib gəlir. Bunun ən bariz və qəti dəlili budur ki, **Əli bin Əbi Talib**'dən Kufə şəhərində minbərdə ikən belə dediyi mütəvatir olaraq rəvayət edilir: "Peyğəmbərindən sonra bu ümmətin ən xeyirliləri Əbu Bəkr və Ömərdir, əgər istəsəniz üçüncüsünü də deyərəm."[1559] Onun bu sözlərini ondan eşidib rəvayət edənlər arasında Əbu Said əl-Xudri, Əbu Musa əl-Əşari, Abdullah bin Abbas, Əbu Cuheyfə, Abdu Xayr əl-Həmədəni, oğlu Muhəmməd bin əl-Hənəfiyyə, Alqamə bin Qeys, Əli bin Rabia əl-Valibi, Əbu Kəsir əl-Ənsari, ən-Nəzzəl bin Səbra, Suveyd bin Ğafələ, Amr bin Mədi Kərib, Abdullah bin Sələmə əl-Muradi, Amr bin Hureys, Əbu Micləz və başqaları var. Minbərdən bunu eşidib rəvayət edənlərin başında Əbu Cuheyfə və Abdu Xayr əl-Həmədəni gəlir; Əbu Cuheyfə səhabədir, Vəhb bin Abdilləh əs-Suvəi əl-Kufidir və Əli bin Əbi Talibin yaxın silahdaşlarından olub, onun mühafizə xidmətinin rəisi kimi çalışıb. Ondan bu xəbəri əl-Həkəm bin Uteybə, oğlu Avn, Zirr bin Hubeyş, əş-Şabi, Əbu İshaq əs-Səbii, Hüseyn bin Abdirrahmən və başqaları rəvayət ediblər. Abdu Xayr bin Yezid əl-Həmədəni isə muxadram təbəqəsinə aiddir, yəni cahiliyyə dövründə doğulub, Əli bin Əbi Talibin ən böyük əshabından olub. Ondan bu xəbəri Əbu İshaq əs-Səbii, Həbib bin Əbi Səbit, oğlu əl-Museyyəb, əş-Şabi, Əbu Həyyə əl-Həmədəni, Xalid bin Alqamə, Mushir bin Abdilməlik, Ata bin Səib və başqaları rəvayət ediblər. Bunu həmçinin Əlinin oğlu Muhəmməd də rəvayət edib. Munzir əs-Səvri bizə Muhəmməd bin əl-Hənəfiyyə'nin belə

[1557] ən-Nuri, "Xatimətu Mustədrak əl-Vasəil", 5/18; Muəssəsətu Al əl-Beyt, 1429

[1558] əl-Kərki, "Umdətul-Məqal fi Kufr Əhl əd-Daləl", səh: 149;

[1559] "Musnəd İbn əl-Cəd", səh: 311; "Musannəf İbn Əbi Şeybə", 18/14 və 21/148; "Fədail əs-Sahabə", 1/76-80, 1/84, 1/91, 1/149, 1/223, 1/300, 1/307, 1/318; "Musnəd Əhməd", 2/201-202, 2/223-224; 2/247, 249, 302-303, 310-311, 316; İbn Əbi Asim, "əs-Sunnə", 2/570;

dediyini rəvayət edir: “Atama dedim: Peyğəmbərindən sonra bu ümmətin ən xeyirlisi kimdir?” Dedi: “Ey oğlum, peyğəmbərindən sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkrdir.” Soruşdum: “Sonra kimdir?” Dedi: “Ömərdir.”[1560] Bunu Muhəmməd bin əl-Hənəfiyyə’dən həmçinin Əbu Məkin Nuh bin Rabiə əl-Ənsari və Əbu Malik əl-Avar rəvayət edir.[1561] Bu xəbər zamanında o qədər məşhur bir xəbər idi ki, Kufənin erkən şiələri Əbu Bəkr və Ömər barəsində aşırılığa gedən şiələri məzəmmət edərək onlara Əlinin bu sözlərini xatırladardılar. Kufənin qazisi Şərik bin Abdilləh bin əl-Haris ən-Nəxai (h. 95-177) öz zamanındakı şiələrə Əlinin bu sözü ilə cavab verərdi. İbrahim bin Əbən deyir: “Şəriki şiələrdən bir qrupa belə dediyini eşitdim: “Ay cahil! Bizim (yəni kufə əhlinin) minbərə qalxarkən və ondan soruşduğumuzda Əlinin dediyini bildiyimiz bir şey var: “Bu ümmətin Peyğəmbərindən sonra ən xeyirlisinin kim olduğunu bilirsiniz? Dedi: “Əbu Bəkr, sonra Ömər!” Ay Cahil! İndi biz ona - “yalan danışırsan!” - deməli idik? Biz ona “sən doğru deyirsən” dedik.”[1562] Qazi Şərik’in bu sözləri Kufədəki erkən təbəqəni təmsil edən şiələrin arasındakı kollektiv yaddaşın misalıdır və Əlinin sözlərinin əks-sədası şiələr arasında bir müddət eşidilib, lakin təəssüf ki, sonradan gələn şiələr bu xəbəri yalanlayıblar və bunu yalanlarla dəf etməyə çalışıblar. Kufə əhlinin nəzdində bunun məşhur olduğunu təsdiq edən maraqlı əhvalatlardan biri də zeydi şiəsi əl-Hafiz İbn Uqdə ilə sünnət əhlinin böyüklərindən olmuş Əbul-Qasim əl-Bağavi arasında baş verib. əl-Xatib əl-Bağdadi deyir: “Əbu Abdilləh Əhməd bin Əhməd bin Muhəmməd bin Əli əl-Qasri bizə xəbər verdi; dedi: Əbu Zeyd əl-Hüseyn bin əl-Həsən bin Amir əl-Kufi belə dedi: ”Əbul-Qasim Abdullah bin Muhəmməd bin Abdilaziz əl-Bəğavi (bir gün) Kufə şəhərinə gəldi; biz Əbul-Abbas Əhməd bin Muhəmməd bin Said bin Uqdə ilə birlikdə onun yanına getdik ki, ondan (hədis) eşidək. Onu soruşduq və cariyə dedi: “Balıq yedi, “fuqqa” içdi və yatdı.” Yaşı çox böyük olduğu üçün onun bu halından Əbul-Abbas təəccübləndi. Sonra bizə izn verildi və onun yanına daxil olduq. O dedi: “Ey Əbul-Abbas! Bacım mənə rəvayət etdi ki, o, Bənu-Himmən məhəlləsində yerləşmişdi və orada bir dəyirmançı var idi. O, köləsinə belə deyərdi: “Əbu Bəkri yüklə!” O da gecədən bir hissə keçənə qədər qatırı yükləyərdi.” Sonra deyərdi: “Öməri yüklə!” Bu zaman kölə gedib

[1560] “Sahih əl-Buxari”, 3468; “Fədail əs-Sahabə”, 1/372;

[1561] İbn Əbi Asim, “əs-Sunnə”, 2/571;

[1562] əl-Xalləl, “əs-Sunnə”, 2/376 (520); Darur-Rayə, 1989, Riyad; Bax həmçinin: əl-Laləkai, “Şərh Usul İtiqad Əhlis-Sunnə val-Cəməa”, 8/1448 (2607); Darut-Tibə, 2003, Riyad. İbn Asəkir, “Tərixu Diməşq”, 44/217;

başqasını yükləyərdi.” Əbul-Abbas ona dedi: “Ey Əbul-Qasim! Əhməd bin Hənbələ olan təəssübkeşliyinə görə Kufə əhli haqqında olmayan bir şeyi söyləmə! “Bu ümmətin Peyğəmbərindən sonra ən xeyirlisi Əbu Bəkr, ondan sonra Ömərdir” xəbərini Əlidən elə məhz Kufə əhli rəvayət etməyibmi?! Lakin Mədinə əhli isə rəvayət ediblər ki, Əli Əbu Bəkrə yalnız altı ay sonra beyət etdi.” Əbul-Qasim ona dedi: “Kufə əhlinə olan təəssübkeşliyin səni Mədinə əhli haqqında olmayanı deməyə vadar etməsin!” Sonra ara yumşaldı və o, kitablarını çıxardı və rəvayət etməyə başladı.”[1563] Bu görüş möhtəmələn üçüncü əsrin sonlarında başlayıb və İbn Uqdə bir zeydi şiəsi kimi etiraf edir ki, bu xəbəri kufəlilər eşidiblər, əzbərləyiblər və nəql ediblər. əz-Zəhəbi'nin, İbn Həcər əl-Heytəmi'nin və başqalarının da təsdiq etdiyi kimi Əlidən nəql edilmiş bu sözlər mütəvatir olaraq gəlir.[1564] əl-Muvaffəq İbn Qudəmə yazır: “Ondan (yəni Əlidən) mütəvatir dərəcəsinə çatmış xəbərlərdə onun belə dediyi məşhurlaşıb: “Allahın elçisindən - salləllahu aleyhi va səlləm - sonra insanların ən xeyirlisi Əbu Bəkr və Ömərdir.”[1565] Alimlərdən bəzisi bunun Əlidən səksəndən çox yoldan rəvayət edildiyini deyib.[1566] Əbu Bəkr əl-Xalləl deyir: “Doxsan nəfər və ya buna yaxın sayda kəs, on nəfəri Allahın elçisinin - salləllahu aleyhi va səlləm - səhabələri, səksən nəfər isə tabiin - rəvayət edib ki, Əli bin Əbi Talib minbər üstündə deyib: “Allahın elçisindən - salləllahu aleyhi va səlləm - sonra insanların ən xeyirlisi Əbu Bəkr və Ömərdir.”[1567] Şiə alimləri bu mütəvatir xəbərin qarşısına tutarlı bir cavab qoya bilməyiblər.[1568] Bu xəbərin yalan olduğunu inkar edə bilmədikləri üçün

---

[1563] əl-Xatib əl-Bağdadi, “Tərixu Bağdad”, 11/329-330;

[1564] əz-Zəhəbi, “Tərixu İsləm”, 2/68 və 2/144; (Bəşşər Avad təhqiqi); İbn Həcər, “əs-Savaiq əl-Muhriqa”, 1/196; Mütəvatir xəbər harada və kimlərdən gəlməyindən asılı olmayaraq hüccət sayılır, çünki mütəvatir xəbər tərif etibarı ilə yalan ola bilməz. Əgər hansısa mütəvatir xəbəri yalançıların ittifaq və işbirliyi ilə uydura biləcəklərini qəbul etsək o zaman İslam dinində Quran da daxil olmaqla heç bir xəbərə etibar qalmaz. Ona görə də biz Əli bin Əbi Talib'in Kufədə minbər üzərində bu sözləri dediyindən əminik.

[1565] İbn Qudəmə, “Minhəc əl-Qasidin fi Fədl əl-Xuləfə ər-Raşidin”, səh: 456;

[1566] İbn Teymiyyə, “Cəmiul-Məsəil”, 7/266;

[1567] İbnul-Mibrad, “Məhdus-Savab”, 1/244;

[1568] əş-Şərif əl-Murtəda “əş-Şəfi” kitabında (3/112-113) bu rəvayəti fərqli bir ləfzlə nəql edir. Bu fərqli ləfzdə rəvayət belədir: “Bu nə yalandır ki, ümmətin peyğəmbərindən sonra ən xeyirlisinin Əbu Bəkr və Ömər olduğunu deyirlər?!” Məsələ burasındadır ki, əş-Şərifin qarşıya qoymağa çalışdığı həmlənin ucuzluğunu və uğursuzluğunu özünün gətirdiyi isnad göstərir. Beləki bu xəbəri Muaz bin əl-Hərs əl-Əftas adlı bir şəxsin rəvayət etdiyini yazır və kitabı təhqiq edən şiə mühəqqiqlər həmin şəxsin kim olduğunu müəyyən edə bilməyiblər. Bu məchul əl-Əftas xəbəri Hafs bin Abdirrahmən əl-Bəlxi'dən, o da Əbu Cənab əl-Kəlbi'dən rəvayət edib. əl-Bəlxi hədisdə müztəribdir, əl-Kəlbi isə zəif ravidir, münkər xəbərlər rəvayət

bunu ya təqiyyə olaraq yozublar, ya da onun sözlərini tamamilə batil mənalara həml etməyə çalışıblar. Əbu Həyyan ət-Təvhidi (h. 310-414) yazır: "Mən 358-ci ildə ən-Nəşi'ni eşitdim. Ona belə bir sual verdilər: "Nasibilərin Əli - radiyallahu anhu - barəsində Kufə minbərində 'Bu ümmətin Peyğəmbərindən sonra ən xeyirlisi Əbu Bəkrdir' dediyini rəvayət etmələrinə nə deyirsən? Ən-Nəşi' belə cavab verdi: "Xəbər səhihdir." İnsanlar bu cavabı eşidəndə boylanaraq ona diqqətlə baxdılar. Mən də heyrət içində susdum. İnsanlar dedilər: "Daha ətraflı izah et!" O dedi: "Bəli. Əli burada bu azmış, fasiq və mürtəd ümmətə işarə etmişdi. Bu dəstənin içində Əbu Bəkr onların arasında ən yaxşısı idi. Yoxsa, sizin tanıdıqlarınız arasında ən xeyirli olan deyil. Ətrafındakılar bu izahı bəyəndilər və onu sevinərək müsbət qarşıladılar."[1569] Burada sözü gedən ən-Nəşi imami şiəsi olmuş ən-Nəşi əl-Əsğar ləqəbi ilə tanınan Əbul-Həsən Əli bin Abdilləh bin Vasif əl-Bağdadi'dir.[1570] Bu məsələ öz zamanında bütün tayfalar arasında o qədər məşhur idi ki, Əlini ən əfzəl səhabə hesab edənlər belə bu həqiqəti etiraf edirdilər. Əlini ən fəzilətli səhabə hesab edənlərdən biri mötəzili alimi Əbul-Qasim əl-Bəlxi yuxarıda Kufənin qazisi Şərik bin Abdilləh'dən gələn xəbəri zikr edir və deyir: "Möminlərin əmirinin fəzilətli saydıqlarının sözlərini inkar etməyimiz mümkün deyildir: "Diqqət edin! Bu ümmətin peyğəmbərindən sonra ən xeyirliləri Əbu

---

etməkdə ittiham olunub. Bəziləri isə ət-Tabərani'nin "əl-Mucəm əl-Əvsət" kitabında (3/138-139) keçən bir rəvayəti cavab olaraq göstərirlər. Rəvayətə görə Həkim bin Cubeyr bu xəbəri Əli Zeynul-Abidinə danışır və and içir ki, Abdu Xayr ona bu xəbəri birbaşa Əlinin özündən eşitdiyini deyib. Zeynul-Abidin isə Əlinin daha əfzəl olduğunu göstərmək üçün mənzilə hədisini rəvayət edir. Hər şeydən əvvəl demək lazımdır ki, Həkim bin Cubeyr'in Zeynul-Abidin'dən rəvayət etdiyi bu xəbərdə Əlidən mütəvatir olaraq sabit olan xəbəri yalanlayan heç bir şey yoxdur. Əgər həqiqətən də bu sözlər Zeynul-Abidin'dən səhihdirsə, bu sadəcə olaraq onun öz rəyini xəbər vermiş olacaq. Lakin bu xəbər ondan səhih deyildir, çünki Həkim bin Cubeyr yalanda ittiham olunmuş bir ravidir. əl-Mufid "əl-İxtisas" kitabında (səh: 128) belə hekayət edir ki, "Həkim bin Cubeyr dedi: "Əbu Cəfər Muhəmməd bin Əli'yə - aleyhuməssələm - dedim: "əş-Şabi bizdə Kufə şəhərində rəvayət edir ki, Əli belə deyib: "Bu ümmətin peyğəmbərindən sonra ən xeyrlisi Əbu Bəkr və Ömərdir." Bunun üzərinə dedi: "Bir kəs sevgisindən və hörmətindən özü kimi olmayan birini özündən üstün görə bilər." Bu rəvayətə inanmalı olsaq ortaya belə bir məna çıxır ki, İmam əl-Baqir iki xəlifənin Əlidən üstün olmadığını, lakin Əlinin bu sözünü onlara olan sevgisi və hörmətindən dediyini qəsd edir.

[1569] ət-Təvhidi, "əl-Bəsair vaz-Zəxair", 4/20-21;

[1570] Əli ibn Abdullah ibn Vasif, Əbu Həsən əl-Həllə, (h. 271-366) "ən-Naşi əl-Əsğar" ləqəbi ilə məşhurdur. Bağdadlı şairlərdəndir, mötəzili kəlam alimlərindən olub. Kəlam elmində mötəzililikdən imamiyyə şiəliyinə keçmiş İbn Növbəxt və başqalarından dərs almış, sonra ustadı kimi mötəzililiyi tərk edib imami şiəsi olmuşdur. Onun "imamət" haqqında bir kitabının olduğunu deyirlər. Əhlul-beytə mədhiyyə qəsidələri ilə tanınıb.

Bəkr və Ömərdir." Elmdə bəsirəti və ya ondan bir nəsibi olan bir kimsə bu xəbəri inkar etməz, lakin bizə görə Əli burada özünü qəsd etməmişdir.[1571] əl-Bəlxi'nin buradakı sözünə diqqət etmək lazımdır; elmdə bəsirəti və ya ondan bir nəsibi olan bir kimsə bu xəbəri inkar etməz, çünki mütəvatir olduğu məlum olan bir xəbərin sübutunda şəkk edilməz. Bu xəbərin əhlüs-sünnət və mötəzili qaynaqlarında keçməsi, imami şiələrin bunu öz kitablarında zikr etməməkləri xəbərə zərər verməz. Çünki əl-Murtəda əş-Şərif'in də dediyi kimi "mütəvatir xəbərlərdə ravilərin adil olması şərt qoşulmaz, əksinə fasiqlərin, hətta kafirlərin rəvayət etdikləri ilə mütəvatirlik sabit olur."[1572] Şiə alimlərdən Cəfər əs-Subhəni də təsdiq edir ki, "imami şiələr əqidə və üsul mövzularında Allahın elçisindən - salləllahu aleyhi va səlləm - etibarlı ravilərin rəvayət etdikləri hədislərlə əməl edirlər və bu rəvayətlərin və hədislərin şiə kitablarında və ya sünnət əhlinin kitablarında olması fərq etməz."[1573]

Ona görə də ilk şiələr Əbu Bəkr və Öməri Əlidən daha fəzilətli hesab edirdilər. Bir nəfər Şərik bin Abdilləhə dedi: "Hansı daha fəzilətlidir, Əbu Bəkr yoxsa Əli?" Dedi: "Əbu Bəkr." Sual sahibi ona dedi: "Şiə olduğun halda belə bir söz deyirsən?!" Dedi: "Bəli, yalnız bunun mislini deyənlər həqiqi şiə ola bilərlər. Allaha and olsun ki, möminlərin əmiri bu taxtaların üstünə çıxaraq demişdi: "Diqqət edin! Bu ümmətin peyğəmbərindən sonra ən xeyirlisi Əbu Bəkr və Ömərdir." Biz indi Əlinin sözünü rədd edəcəyik?! Yoxsa onu yalanlayacağıq?! Allaha and olsun ki, Əli yalançı deyildi."[1574] Əli bin Əbi Talib'dən yenə onun minbərdə belə dediyi rəvayət olunur: "Məni Əbu Bəkr və Ömərdən əfzəl hesab edən hər kimi görsəm onu müftəri həddi ilə cəzalandıraram."[1575] İbn Asəkir bunu fərqli isnadları ilə Əbul-Həkəm Həcəl əl-Basri, Abdurrahmən bin Əbi Leylə əl-Kufi və Alqamə bin Qeys'dən rəvayət edir. İbrahim ən-Nəxai deyir: "Alqamə bin Qeys öz əlini (Kufə məscidinin) minbərinə vurdu və dedi: "Əli bu minbər üzərində xütbə verdi. Allaha həmdü-səna gətirdi və sonra dedi: "Mənə

---

[1571] əl-Qadi Abdulcabbar, "Təsbit Dəlail ən-Nubuvvə", 1/62-63; əl-Bəlxi iddia edir ki, Əli bin Əbi Talib - kərraməllahu vachəhu - "bu ümmətin peyğəmbərindən sonra ən xeyirlisi" deyərkən özünü də onların arasında qəsd etmirdi. əl-Bəlxi'nin bu cavabı sözün aşkar mənasına müxalif bir izahdır, çünki Əli də peyğəmbərdən sonrakı ümmətin bir hissəsidir, özünü qəsd etməməsi mümkün deyildir.

[1572] əl-Murtəda əş-Şərif, "Rasəil əş-Şərif əl-Murtəda", 3/311;

[1573] əs-Subhəni, "əl-Aqidətu əl-İsləmiyyə alə Dəv Mədrəsəti Əhl əl-Beyt", səh: 317;

[1574] əl-Qadi Abdulcabbar, "Təsbit Dəlail ən-Nubuvvə", 1/62-63

[1575] İbn Əbi Asim, "əs-Sunnə", 2/575; İbn Asəkir, "Tarix Diməşq", 30/383 və 44/365;

xəbər çatır ki, bir qrup insan məni Əbu Bəkr və Ömərdən daha əfzəl görürlər. Bununla bağlı qabaqcadan tədbir görəsi olsaydım buna görə cəzalandırardım… kim belə bir şey deyərsə o iftira atmışdır və ona iftira atanın cəzası düşür…"[1576] Çox maraqlıdır ki, Əlinin fəzilətlərinə dair sünnət əhlinin kitablarında keçən xəbərləri təsdiqləyən şiələr eyni ravilər tərəfindən rəvayət olunmuş bu kimi xəbərləri təsdiqləməkdən imtina edirlər. Buna görə də əl-Qadi Abdulcabbar deyir: "Əgər desələr ki, "biz bunu təsdiqləmirik", deyərik ki, sizin "mən kimin mövlasıyamsa Əli də onun mövlasıdır" sözünü təsdiqləməyiniz, bunu isə təsdiqləməməyiniz təəccüblüdür, halbuki bunun rəvayət yolları daha güclüdür."[1577] əl-Qadi Abdulcəbbar burada ikili standardlara diqqət çəkir. Çünki bu xəbərin yalan ola biləcəyini iddia etmək mümkündürsə eyni şəkildə Ğadirxum kimi xəbərləri də inkar etmək mümkün olacaq, lakin ikincisini qəbul edib Əlinin öz şahidliyini rədd etmək prinsipial olaraq bir ziddiyyətdir.

Əhlul-beytin böyükləri - dediyimiz kimi - imami şiələrin etiqadından uzaq idilər. Əbu Xalid əl-Əhmər deyir: "Abdullah bin Həsən (əl-Musənnə)dən Əbu Bəkr və Ömər haqqında soruşdum. Dedi: "Onlara Allahın salavatı olsun! Onlara xeyir-dua etməyənlərə Allah rəhm etməsin!"[1578] Həmçinin İmam Əhməd şeyxi Muhəmməd bin Fudeyl vasitəsilə rəvayət edir ki, şiə ravi Səlim bin Əbi Həfsa deyib: "Əbu Cəfər və Cəfər'dən Əbu Bəkr və Ömər haqqında soruşdum və hər ikisi mənə dedi: "Ey Səlim! Onları sev və onların düşmənlərindən bəraət et! Çünki onların hər ikisi də hidayət imamları idilər." Cəfər mənə dedi: "Ey Səlim! Əbu Bəkr mənim babamdır, məgər insan öz babasını söyərmi?" Dedi: "Əgər onları sevməsəm və düşmənlərindən bəraət etməsəm qiyamət günü Muhəmmədin şəfaəti mənə çatmasın!"[1579] Həmçinin İsa bin Dinar əl-Muəzzin deyir: "Əbu Cəfər'dən Əbu Bəkr və Ömər haqqında soruşdum. Dedi: "Müsəlmandırlar, Allah onlara rəhm etsin!" Ondan soruşdum: "Onları sevməli və onlar üçün istiğfar etməliyəmmi?" Dedi: "Bəli!" Soruşdum: "Bunu mənə əmr edirsən?" Üç dəfə "bəli" dedi: "O ikisi ilə bağlı başına nə gəlsə mənim boynumadır" və əlini boynuna qoydu. Dedi: "Əli

---

1576 İbn Əbi Asim, "əs-Sunnə", 2/480; Abdullah, "əs-Sünnə", 2/588; İbn Şəhin, "Şərh Məzhəb Əhl əs-Sunnə", səh: 316 (198);

1577 əl-Qadi Abdulcabbar, "Təsbitu Dəlail ən-Nubuvva", 2/548;

1578 əl-Xatib əl-Bağdadi, "əl-Cami li Əxləq ər-Ravi", 2/106; İbn Asəkir, "Tərixu Diməşq", 27/373;

1579 Abdullah, "Fədail əs-Sahabə", 1/175 (rəq: 176);

Kufədə beş il idarə etdi və onlar haqqında xeyirdən başqa bir şey söyləmədi. Mənim atam da o ikisi haqqında xeyirdən başqa bir şey deməyib, mən də xeyirdən başqasını demirəm."[1580] Eləcə də Talləb bin Həvşəb əş-Şeybəni deyir: "Cəfər bin Muhəmməd bizə dedi: "Mənim atam (İmam əl-Baqir) və babam (İmam əs-Səccad) Əbu Bəkr və Öməri sevirdilər, ondan bəraət etmirdilər." Cəfər bin Muhəmməd dedi: "Axı niyə onları sevməyim, onlar bizə atalıq ediblər. Bunu təqiyyə olaraq deyənə Allah ona lənət etsin!"[1581] Həmçinin Bəssəm bin Abdilləh əs-Sayrafi deyir: "Əbu Cəfər'dən soruşdum: "Əbu Bəkr və Ömər haqqında nə deyirsən?" Dedi: "Allaha and olsun ki, onları sevirəm və onlar üçün istiğfar edirəm. Əhlu beytimdən elə bir kimsə ilə qarşılaşmadım ki, onları sevməsin."[1582] Kəsir bin Bəyya ən-Nəvva deyir: "Mədinədə Əbu Cəfər'yanına gəldim və üstündə xurma qolu olan bir süfrə gətirilməsini istədi. Onlar böyük bir qab və ət suyu ilə isladılmış çörək (sərid) gətirdilər. Xurma da gətirdilər, biz (onları) yedik. Bundan sonra ona dedim: "Əbu Bəkr və Ömər haqqında nə deyirsən?" Dedi: "Onlar hakimiyyətə gəldilər, ədalətlə davrandılar, ona görə də onları sev!" Mən bunun üzərinə ona dedim: "İnsanlar deyirlər ki, sən bunu təqiyyə olaraq deyirsən." Dedi: "Təqiyyə dirilərə qarşı edilər, ölülərə qarşı edilməz."[1583] Rəvayət olunur ki, "bir qrup iraqlı bir araya toplaşaraq Əbu Bəkir və Ömər haqqında pis danışdılar və sonra Osmanı tənqid etməyə başladılar. İmam Zeynul-Abidin onlara dedi: "Mənə deyin, siz öz yurdları və mallarından uzaqlaşdırılan, Allahdan lütf və riza diləyən, Allah və Rəsuluna yardım edən yoxsul mühacirlərdənmisiniz?" [59:8] Onlar cavab verdilər: "Biz onlardan deyilik." O, yenə soruşdu: "Onda siz "onlardan əvvəl orada (Mədinədə) yurd salmış və iman gətirmiş, öz yanlarına hicrət edənləri sevən kimsələrdənsiz?" [59:9] Onlar yenə cavab verdilər: "Biz onlardan deyilik." Onda onlara dedi: "Yaxşı, siz özünüz etiraf etdiniz və özünüzə qarşı şəhadət verdiniz ki, nə bunlardansınız, nə də o birilərdən. Mən də şəhadət verirəm ki, Allahın haqqında 'Onlardan sonra gələnlər deyərlər: Ey Rəbbimiz, bizi və bizdən öncə iman gətirmiş qardaşlarımızı bağışla və qəlblərimizdə iman gətirənlərə qarşı heç bir kin bəsləmə" [59:10] dediyi üçüncü qrupdan da deyilsiniz. Elə isə mənim yanıma yaxın durmayın — Allah sizə bərəkət verməsin və evlərinizi sizdən uzaq

---

[1580] əd-Dəraqutni, "Fədail əs-Sahabə", səh: 65 (rəq: 38)

[1581] əs-Səmmən, "Kitəbul-Muvafəqati beynə Əhlil-Beyti vas-Sahabə", səh: 39 (19)

[1582] əd-Dəraqutni, "Fədail əs-Sahabə", səh: 64 (rəq: 37)

[1583] əs-Səmmən, "Kitəbul-Muvafəqati beynə Əhlil-Beyti vas-Sahabə", səh: 40 (21)

etsin. Siz İslama istehza edirsiniz və onun əhlindən deyilsiniz."[1584] Şiə alimlərindən Haşim Məruf əl-Həssəni yazır: "Bu hadisə həmçinin onun oğlu İmam Muhəmməd əl-Baqir'dən - aleyhissələm - rəvayət olunub və bunun onların hər ikisində də təkrarlanması və ikincisinin də birincisi ilə eyni cavabı verməsi mümkündür. Çünki məntiqləri birdir, hədəfləri birdir, heç kimə yaltaqlıq etməzlər, heç kimin maraqlarını güdmürlər, Allahın və bəşəriyyətin ən xeyirlisinin razılığını qazanmaqdan başqa heç bir şey onları maraqlandırmaz."[1585] əs-Saduq öz isnadı ilə rəvayət edir ki, Cəfər əs-Sadiq səhabələr haqqında deyib: "Allahın Rəsulunun - salləllahu aleyhi va əlihi - səhabələri on iki min nəfər idi: səkkiz min nəfər Mədinədən, iki min nəfər Məkkədən və iki min nəfər isə "*tuləqa*" arasından idi. Onların arasında nə qədəri, nə mürci, nə həruri, nə mötəzili, nə də rəy əshabı var idi. Onlar gecə-gündüz ağlayırdılar və deyirdilər: "Bişmiş yumşaq çörək yemədən ruhlarımızı al, ey Allah!"[1586] Əlbəttə ki, bu vəsf ilə tərif olunan bir qövm nifaq əhli ola bilməz. əl-Kuleyni'nin rəvayət etdiyi bir xəbərdə Mənsur bin Həzim deyir: "Əbu Abdilləh'ə - aleyhissələm - dedim: "Mənə Allahın Rəsulunun – sallallahu aleyhi və alih – səhabələri[1587] haqqında xəbər ver; onlar Mühəmmədin - salləllahu aleyhi va əlihi - adından doğru danışıblar yoxsa yalan danışıblar?" Dedi: "Əksinə, doğru danışıblar." Mən dedim: "Bəs nə üçün aralarında ixtilaf baş verdi?" Dedi: "Bilmirsən ki, bir adam Allahın Rəsulunun – sallallahu aleyhi və alih – yanına gələrdi, bir

---

[1584] İbn Kəsir, "əl-Bidəyə van-Nihəyə", 9/285;

[1585] əl-Həssəni, "əl-Məvduat fil-Əsər val-Əxbər", səh: 180;

[1586] əs-Saduq, "əl-Xisal", səh: 639-640; əs-Saduq bunu Əhməd bin Ziyad bin Cəfər əl-Həmədəni'dən, o da Əli bin İbrahim əl-Qummi'dən, o isə atası İbrahim bin Haşim'dən, o da Muhəmməd bin Əbi Umeyr'dən, o Hişəm bin Səlim'dən, o da İmam əs-Sadiq'dən rəvayət edir. Şiə ricəl alimlərinə görə ravilərin hamısı siqadır.

[1587] Rəvayətdə səhabələrin doğru sözlü olmasına dair şahidliyin olması əl-Məzəndərani kimi şiə alimlərinin qəbul edə bilmədiyi bir həqiqət olduğu üçün hədisi təvil etməyə çalışmışlar, beləki əl-Məzəndərani "Şərh Usul əl-Kəfi" kitabında (2/326-327) deyir: "Mənsur (burada) Peyğəmbərin – sallallahu aleyhi və alih – kəlamını qoruyub saxlayan mömin səhabələrin halı barəsində soruşur. Çünki sən artıq öncədən bilmisən ki, münafiqlər və onun kəlamında yanıla biləcək bəzi möminlər ona iftira atmış, yalan demişdilər." Şiə alimlərinin verdikləri standart izah budur. Lakin bu izahın batil olduğu çox aşkardır, beləki ixtilaf şiələrin qəbul etdikləri bir əlin barmaqlarına sığacaq sayda olan səhabələr arasında baş verməmişdi, ixtilaf məhz ümumi səhabələr arasında baş vermişdi, əks təqdirdə verilən sual çox mənasız görünür. İkincisi isə Mənsurun qəsdi əgər - əl-Məzəndərani'nin - dediyi kimi - "peyğəmbərin kəlamını qoruyub saxlayan mömin səhabələri" qəsd edirsə o zaman Mənsur artıq səhabələrin içərisində doğru danışanlar ilə yalan danışanlar arasında ayırım etmiş olmalı idi, bundan sonra onun dönüb İmamdan səhabələrin Allahın peyğəmbərinin - aleyhissalətu vassələm - adından doğru yoxsa yalan danışdıqlarını soruşması mənasız qalır.

məsələ barədə soruşardı və Peyğəmbər ona cavab verərdi. Sonra isə elə olardı ki, o cavabı nəsx edən (dəyişdirən) yeni bir cavab gələrdi. Beləliklə, hədislərin bəziləri bəzilərini nəsx etmişdir."[1588] Həmçinin İmam Əli - kərraməllahu vachəhu - səhabələri bu sözləri ilə vəsf edirdi: "Mən Məhəmmədin – sallallahu aleyhi və alih – səhabələrini gördüm, lakin bu gün heç kəsi onlara bənzər görmürəm. Onlar səhəri pərişan və toz-torpaq içində açardılar. Gecəni isə səcdə və qiyamda keçirərdilər. Alnı ilə yanağı arasında növbələşər, axirəti xatırladıqları üçün köz üstə dayanmış kimi titrəyərdilər. Uzun səcdələrdən alınlarının ortasında keçi dizinə bənzər izlər əmələ gəlmişdi. Allah anıldıqda göz yaşları sel kimi axar, yaxalarını isladardı. Onlar, ilahi əzabdan qorxaraq və savaba ümid edərək, güclü küləkdə yellənən ağac kimi titrəyərdilər."[1589]

## Əlinin öz qızını Ömərlə evləndirməsi

Erkən tarixdən nümunələr onu göstərir ki, səhabələrin böyükləri ilə əhlul-beyt arasında çox isti münasibətlər olub. Əlinin öz doğma qızı Ummu Kulsum'u Ömərə ərə verməsi də bu mənanı dəstəkləyir. Əgər İmam Əli ilə Ömər bin əl-Xattab - radiyallahu anhumə - arasındakı münasibət - şiələrin iddia etdikləri kimi - nifrət və düşmənçilik ilə yüklü olsaydı nə üçün Əli, Fatimədən olan qızını xəlifə Ömərə ərə verdi?! Onların arasındakı bu qohumluq bağı onların arasındakı münasibətlərin doğmalığına, yaxınlığına dəlalət edir. Üstəlik bu evlilik Ömərin məqamına da dəlalət edir, çünki qəbul olunduğu kimi mömin bir qızı vəlisi yalnız və yalnız ona tay (kəfi) olan birinə verməlidir.[1590] Şübhəsiz ki, Fatimə və Əlidən olan bir qız əhlul-beytin qeyrəti və şərəfi olaraq ona layiq olmayan birinə ərə verilə bilməzdi. Ona görə də əhlüs-sünnət məzhəbləri, həmçinin mötəzili alimlər

---

[1588] əl-Kuleyni, "əl-Kafi", 1/65; əl-Məclisi "Miratul-Uqul" kitabında (1/216) həsən olduğunu, əl-Muhsini isə "Mucəmul-Əhədis əl-Mutəbəra" kitabında (1/536) səhih olduğunu deyir.

[1589] ər-Radi, "Nəhcul-Bələğa", 1/189-190;

[1590] Bax: əl-Kərki, "Cəmi əl-Məqasid", 12/128-130;

şiələrin səhabələr haqqında təsəvvürlərinin xətalı olduğunu göstərmək istədikdə gətirdikləri dəlillər arasında bu evliliyi misal göstərirlər.

Bu evlilik imamların zamanında şiələr tərəfindən qəbul olunurdu və bunun baş verdiyini inkar etmirdilər. əl-Kuleyni isnadı ilə rəvayət edir ki, Süleyman bin Xalid deyib: "Əbu Abdilləh'dən - aleyhissələm - əri ölmüş qadının iddətini harada keçirməli olduğunu soruşdum: ərinin evində yoxsa istədiyi yerdə? Dedi: "Əksinə istədiyi yerdə." Sonra dedi: "Ömər öldükdə Əli Ummu Kulsum'un yanına gəldi, əlindən tutub onu evinə apardı."[1591] Şeyxut-Taifə ət-Tusi də bu rəvayəti həm "əl-İstibsar" kitabında, həm də "Təhzib əl-Əhkəm" kitabında gətirir. Cəfər əs-Sadiq'in bu dediyi əhlüs-sünnət qaynaqlarında da öz təsdiqini tapır. İmam əş-Şafi deyir: "İbn Mehdi bizə Sufyan'dan, o da Firas'dan, o isə əş-Şabi'dən belə dediyini xəbər verdi: "Ömər qətl edildikdən yeddi gecə sonra Əli - radiyallahu anhu - Ummu Kulsumu apardı."[1592] Həmçinin İbn Əbi Şeybə deyir: "Cərir bin Abdulhəmid bizə Mənsur'dan, o da əl-Həkəm (bin Uteybə)dən belə dediyini rəvayət edir: "Ömər öldükdə Əli Ummul-Kulsum'u (evinə) apardı."[1593] Said bin Mənsur isə deyir: "Huşeym bizə xəbər verdi; dedi: Yunus bizə əl-Həsən (əl-Basri'dən), o da Əlidən rəvayət etdi ki, "o, Ömər öldükdə Ummu Kulsumu apardı, onu iddət müddətində apardı."[1594] Əbu Hənifə isə şeyxi Həmməd vasitəsilə İbrahim ən-Nəxai'dən belə dediyini rəvayət edir: "Ömər qətl edildikdə Əli (qızı) Ummu Kulsumu yalnız ona görə (evinə) apardı ki, çünki o, Ömər ilə birlikdə xilafət evində yaşayırdı."[1595] İbrahim ən-Nəxai'nin dediyini həmçinin Əyyub əs-Səxtiyəni və Sufyan əs-Səvri də deyib. Əli bin Əbi Talib'in öz qızını evdən götürüb aparması məsələsi o qədər məşhurdur ki, bunu sələfdən bir çox kimsə müxtəlif isnadlarla qeyd edir. Gördüyümüz kimi əhlul-beyt imamları da bunu təsdiqləyiblər. Bu ravilərin - yəni əş-Şabi, əl-Həkəm, İbrahim, əl-Həsən əl-Basri - heç biri əlbəttə ki, xəlifə Ömərin qətl edildiyi ildə buna şahid olmayıblar, içlərində Amir əş-Şabi ən yaşlı olanlarıdır və bir rəvayətə görə o, Ömər öldürülmədən altı il əvvəl doğulmuşdu. Lakin bu evlilik o qədər fərqli sənədlər və mətnlərlə öz təsdiqini tapıb ki, buna şübhə

---

[1591] əl-Kuleyni, "Furu əl-Kəfi", 6/115-116; əl-Məclisi "Mirətul-Uqul" kitabında (21/199) isnadının səhih olduğunu deyir. Eyni babda keçən eyni məzmunlu hədisin bir digər isnadı üçün "muvassəq" hökmü verir.

[1592] əş-Şafi, "əl-Umm", 7/182

[1593] İbn Əbi Şeybə, "əl-Musannəf", 10/387 (19962)

[1594] "Sünən Said bin Mənsur", 1/360 (1350)

[1595] Əbu Yusuf, "əl-Əsər", səh: 143 (rəq: 648);

etmək mümkün olsaydı tarixi hadisələrin hamısına şübhə etmək mümkün olardı. Ona görə də şiələrin məşhur nəsəb alimləri bu evliliyin baş verdiyini təsdiq ediblər. İbnus-Sufi adı ilə tanınmış Əbul-Həsən Əli bin Muhəmməd əl-Uməri əl-Ələvi (vəfatı h. 460) "əl-Məcdi fi Ənsəb ət-Talibin" kitabında bu evliliyi təsdiqləyir. Həmçinin İbn Funduq adı ilə məşhurlaşmış nəsəb alimi Əbul-Həsən əl-Beyhəqi (h. 499-565) "Lubəb əl-Ənsəb" kitabında, digər nəsəb alimi İbnut-Tiqtaqa əl-Həsəni əl-Ələvi (h. 660-709) "əl-Əsili" kitabında bu evliliyin baş verdiyini yazırlar.[1596] Şiə tarixçi alimlərdən əl-Yaqubi (vəfatı h. 292) Əlinin və Fatimənin qızı Ummu Kulsum ilə Ömərin evləndiyini, ona on min dinar mehr verdiyini yazır.[1597] ət-Tabərsi də (h. 468-548) "İləmul-Vara" kitabında bu evliliyin baş verdiyini deyir.[1598]

Əhlüs-sünnət qaynaqlarında əhlul-beytin imamlarından da eyni məna rəvayət olunur. Tanınmış sira müəllifi İbn İshaq deyir: "Əbu Cəfər mənə atası Əli bin əl-Hüseyn'dən belə dediyini rəvayət etdi: "Ömər bin əl-Xattab Əlinin qızı Ummu Kulsum ilə evləndikdə Allahın elçisinin - salləllahu aleyhi va səlləm - məscidinə, qəbir ilə minbər arasında oturan mühacirlərin - orada yalnız onlar otururdu - yanına gəldi. Onun üçün bərəkət duası etdilər və (Ömər) dedi: "Allaha and olsun ki, onunla ailə qurmaq istəyimin yeganə səbəbi Allahın elçisindən - salləllahu aleyhi va səlləm - eşitdiyim bu sözlərdir: "Mənim nəsəbim və səbəbimdən olanlardan başqa hər bir səbəb və nəsəb Qiyamət günü qopmuş olacaq."[1599] Bu isnaddakı Əbu Cəfər məşhur imam Muhəmməd əl-Baqir'dir və bunu atası Zeynul-Abidin'dən nəql edir. Bunu İmam əl-Baqir'dən təkcə İbn İshaq yox, həmçinin siqa ravi Vuheyb bin Xalid də rəvayət edir. əl-Beyhəqi Vuheyb'dən gələn isnadla paralel olaraq İbn İshaq'ın da isnadını qeyd edir və deyir: "Bu, həsən mürsəldir; başqa kanallarla da həm məvsul olaraq, həm də mürsəl olaraq rəvayət olunub."[1600] Bu xəbəri həmçinin Muhəmməd əl-Baqir öz adından da rəvayət edib. İbn Sad "ət-Tabəqat əl-Kubra" kitabında deyir: "Ənəs bin İyad əl-Leysi mənə Cəfər bin Muhəmməd'dən, o da atasından rəvayət etdi ki, "Ömər bin əl-Xattab Əli bin Əbi Talib'dən

---

[1596] İbnus-Sufi, "əl-Məcdi", səh: 199; İbn Funduq, "Lubəb əl-Ənsəb", səh: 337; İbnut-Tiqtaqa, "əl-Əsili", səh: 58;

[1597] "Tərix əl-Yaqubi", 2/40;

[1598] ət-Tabərsi, "İləmul-Vara bi Aləm əl-Hudə", 1/397;

[1599] "Siratu İbn İshaq", səh: 249; Darul-Fikr, Beyrut, 1978

[1600] əl-Beyhəqi, "əs-Sunən əl-Kubra", 13/544-545 (13524); həmçinin bax: əl-Acurri, "əş-Şəriah", 5/2231 (1713);

qızı Ummu Kulsum'un əlini istədi. Əli dedi: "Mən qızlarımı Cəfərin oğulları üçün saxlamışam." Ömər dedi: "Onu mənə ərə ver, ey Əli! Allaha and olsun ki, Yer üzündə elə kimsə yoxdur ki, mənim kimi onun üçün nəzərdə tutduğum gözəl yoldaşlığı edə bilsin." Əli dedi: "Evləndirdim." Bunun üzərinə Ömər (məsciddə) qəbir ilə minbər arasındakı mühacirlərin məclisinə gəldi, onlar - Əli, Osman, əz-Zubeyr, Talha, Abdurrahmən bin Auf - orada oturardılar. Ömərə uzaq yerlərdən bir xəbər gəldikdə onların yanına ora gələrdi və onlarla istişarə edərdi. Bu zaman da Ömər gəldi və dedi: "Məni evlilik münasibətilə təbrik edə bilərsiz." Dedilər: "Kiminlə?" Dedi: "Əli bin Əbi Talib'in qızı ilə" və sonra onlara xəbər verdi ki, "Peyğəmbər - salləllahu aleyhi va səlləm - deyib: "Mənim nəsəbim və səbəbimdən başqa bütün nəsəb və səbəblər Qiyamət günü qopacaq." Ona səhabəlik etmişdim, istədim ki, bu da olsun."[1601] Bunu həmçinin Said bin Mənsur "əs-Sünən" kitabında Abdulaziz bin Muhəmməd əd-Dəravardi yolu ilə Cəfər əs-Sadiq'dən, o da atasından rəvayət edir. ət-Təbərani "əl-Mucəm əl-Əvsət" kitabında deyir: "Muhəmməd bin Abdilləh əl-Hədrami bizə rəvayət etdi; dedi: əl-Həsən bin Səhl əl-Hənnət bizə xəbər verdi; dedi: Sufyan bin Uyeynə bizə Cəfər bin Muhəmməd'dən, o da atasından, o isə Cabir'dən belə dediyini xəbər verdi: "Ömər bin əl-Xattab'ı Əlinin qızı ilə evləndikdə insanlara belə deyərkən eşitdim: "Məni təbrik etməyəcəksizmi? Allahın elçisini - salləllahu aleyhi va səlləm - belə deyərkən eşitdim: "Mənim səbəbim və nəsəbimdən başqa bütün səbəb və nəsəblər Qiyamət günü kəsiləcək."[1602] əl-Həsən bin Səhl məchuldur, amma bunu Sufyan'dan həm də İmam İshaq bin Rahaveyh də nəql edir.[1603] əl-Acurri deyir: "İbn Əbi Davud bizə xəbər verdi; dedi: İshaq bin Mənsur əl-Kəvsəc bizə rəvayət etdi; dedi: Ubeydullah bin Musa bizə İsrail'dən, o da Osman bin əl-Muğira'dan, o isə Muhəmməd bin Əli'dən belə dediyini rəvayət etdi: "Ömər insanların yanına çıxdı və dedi: "Məni Allahın elçisinin - salləllahu aleyhi va səlləm - qızı ilə evlənməklə təbrik edin!" Onlar da təbrik etdilər. Sonra dedi: "Allahın elçisinə səhabə olmuşdum, lakin Allahın elçisini - salləllahu aleyhi va səlləm - belə deyərkən eşitdim: "Mənim səbəbim və nəsəbimdəm başqa bütün səbəb və nəsəblər Qiyamət günü qopacaq."[1604] Rəvayətin isnadındakı bütün ravilər siqadır. Bunu

---

[1601] İbn Sad, "ət-Tabəqat əl-Kubra", 8/463 (Dar Sadir)

[1602] ət-Tabərani, "əl-Mucəm əl-Əvsət", 5/376 (5606);

[1603] İbn Həcər, "əl-Mətalib əl-Aliyə", 3989

[1604] əl-Acurri, "əş-Şəriah", 5/2232 (1714);

həmçinin İshaq bin Rahaveyh Yəhya bin Adəm'dən, o isə Şərik bin Abdilləh ən-Nəxai'dən, o Urva əl-Cufi'dən, o da Əbu Cəfər Muhəmməd bin Əli'dən rəvayət edir.[1605] Bu evliliyi İmam Zeynul-Abidin və oğlu İmam əl-Baqir'dən başqa tabiin nəslinin tanınmış şəxsiyyətləri də səhih isnadlar ilə rəvayət ediblər. Bunların arasında İbn Abbas'ın azadlı köləsi İkrimə və Ata əl-Xorasani'nin adları keçir.[1606]

Müasir zamanımızda isə şiələrin böyük bir qismi belə bir evliliyin ümumiyyətlə baş verdiyini inkar etməyə çalışırlar,[1607] çünki onlar Əli ilə Ömər arasında xəyal etdikləri o düşmənçiliyi bu evlilik ilə bir araya gətirə bilmirlər. Axı Öməri, nə az, nə çox peyğəmbərin - salləllahu aleyhi va səlləm - mübarək qızı Fatiməni qapı arasında qoyub yaralamaqda, dolayısıyla onu şəhid etməkdə ittiham edirlər. Öməri Əlinin haqqını yeməkdə, onun imamlığını çeynəməkdə ittiham edirlər. Bütün bunlardan sonra İmam Əli necə öz canparasını Ömər kimi birinə ərə verə bilərdi?! Bu sual əlbəttə ki, şiə əqlini narahat edir. Şiə müəlliflər içərisində bu evliliyi ilk inkar edənin əl-Həsən bin Muhəmməd bin əl-Həsən əl-Qummi (vəf. h. 385) olduğu yazılır. O, bunu "Tərixu Qum" kitabında deyib. Lakin bu müəllifin kimliyi və həyatı haqqında şiə kitablarında heç məlumat ilə rastlaşmaq olmur. ən-Nəcəşi və ət-Tusi vaxt baxımından ona yaxın bir zamanda yaşamış olmaqlarına baxmayaraq onun haqqında heç bir şey yazmırlar, ümumiyyətlə heç bir şiə tarixçi alim hansısa qaynaqlara əsasən onun tərcümeyi-halını yaza bilməyib.[1608] Bu evliliyi inkar etmək rəyini şiələrin arasında məşhurlaşdıran isə ilk dəfə əl-Mufid olub. O, "əl-Məsəil əs-Səraviyyə" kitabında deyir: "Möminlərin əmirinin - aleyhissələm - qızını Öməre ərə verməsi xəbəri sabit deyildir, onun rəvayət yolu əz-Zubeyr bin Bəkkar'dan gəlir və o, nəqldə etibarlı olmayıb, zikr etdiklərində ittiham olunub. Möminlərin əmirinə nifrət edərdi, Haşim oğulları haqqında

---

[1605] İbn Həcər, "əl-Mətalib əl-Aliyə", 3989;

[1606] Abdurrazzaq, "əl-Musannəf", 6/163 (10354); əl-Acurri, "əş-Şəriah", 1712 və 1819;

[1607] Bax: Nasir əl-Musəvi əl-Hindi, "İfhəmul-Adə val-Xusum", Muhəmməd Əli əl-Huluv, "Kəşful-Bəsar", Ubeyd əl-Kəlbəni əl-Amməni, "Həl Təzavvacə Umər bi Ummi Kulsum", Saleh əl-Muhəmmədəvi, "Ummu Kulsum". Bunu həmçinin İbrahim əl-Bəhrani "əl-Məsəil" kitabında (39), İsmail əl-Ənsari "əl-Məvsua əl-Kubra"da (3/383 və 7/339), Muhəmməd əl-Vahidi "İhqaq Aqaid əş-Şiə" kitabında (səh: 133), Xalid əl-Bağdadi "Təshih əl-Qiraə" kitabında (səh: 109-110) və başqaları inkar edirlər.

[1608] Bax: Muslim əd-Dəvari, "Usul İlm ər-Ricəl: Beynən-Nəzariyyəti vat-Tətbiq", səh: 374-375; əl-Həsən əl-Qummi bu kitabında evliliyi inkar etmək rəyini əl-Fədl bin Şazan'a nisbət edir, lakin bunun üçün heç bir isnad qeyd etmir. əd-Dəvari'nin kitab haqqında onun "qeyri-mötəbər" olduğunu yazdığını nəzərə alsaq belə bir nisbətin səhih olmadığını deməliyik.

iddia etdiklərində güvənilən biri deyildir."[1609] əl-Mufid'in ortaya qoyduğu bu mövqe elmi cəhətdən həddindən artıq absurddur, çünki onun bu xəbərin əz-Zubeyr bin Bəkkər'dən asılı olmadığını bilməməsi tamamilə imkansızdır. Əksinə əminliklə deyə bilərik ki, əl-Mufid çox gözəl bilirdi ki, bu evliliyi həm sünni, həm də şiə qaynaqları bir-birindən həddindən artıq fərqli yollarla rəvayət ediblər. Misal üçün bir rəvayətdə əl-Buxari deyir: "Abdən bizə rəvayət etdi: Abdullah bizə xəbər verdi; Yunus bizə İbn Şihəbdən xəbər verdi; Saləbə bin Əbi Malik dedi ki, Ömər bin əl-Xattab – radiyallahu anhu – Mədinənin qadınları arasında bəzi paltarlar bölüşdürdü və sonunda yaxşı bir paltar qaldı. Onun yanındakılardan bəziləri ona dedilər: "Bunu sənin evindəki peyğəmbərin – salləllahu aleyhi va səlləm – qızına ver!" Bununla Əli'nin qızı Umm Kulsum'u qəsd edirdilər. Ömər dedi: "Umm Səlit buna daha layiqdir" və Umm Səlit peyğəmbərə – salləllahu aleyhi va səlləm – beyət etmiş ənsar qadınlarındandır. Ömər dedi: "O, bizə Uhud günü su daşıyardı."[1610] Gördüyümüz kimi bu rəvayətdə Ömərin Ummu Kulsum ilə evli olduğu tamamilə başqa bir məzmunda qeyd olunur. İbn Əbi Şeybə "əl-Musannəf" kitabında İbn Uleyyə'dən, o Əyyub'dan, o (İbn Ömərin azadlı köləsi) Nəfi'dən, o da İbn Ömər'dən belə dediyini rəvayət edir: "Əliyə beyət edildikdə mənim yanıma gəldi və dedi: "Sən Şam əhli yanında sevilən birisən, ona görə də mən səni onların üzərində vali təyin edirəm, ora doğru yola düş!" Dedi: "Mən onunla aramızdakı qohumluğu və evlilik bağlarını zikr etdim. Bundan sonra dedi: "Bundan ötəsinə gəldikdə isə (Şama vali olmaq işində) sənə beyət etməyəcəm." Dedi: "Məni tərk etdi və çıxıb getdi." Bundan sonra İbn Ömər anasının, Ummu Kulsum'un yanına getdi, onunla salamlaşdı və Məkkəyə yola düşmək üçün hazırlaşdı. Əli gəldi və ona dedilər ki, İbn Ömər Şama tərəf yola düşdü. Bunun üzərinə insanlar səfərbər oldular; onlardan kimisi ridasını dəvəsinin boynuna atacaq qədər tələsirdi. Ummu Kulsum'un yanına gəldim, ona xəbər verdim, o da atasına xəbər göndərdi ki, "sən nə edirsən? Adam mənim yanıma gəldi, məni ziyarət edib salam verdi və Məkkəyə doğru yola düşdü." Bunun üzərinə insanlar qayıtdılar."[1611] Bu xəbərdə isə ən-Nəfi Əlinin qızı Ummu Kulsum'u öz mövlası İbn Ömər'in anası adlandırır, məlumdur ki, Ummu Kulsum İbn Ömərin doğma anası olmayıb, lakin atası ilə evli olub, qardaşı Zeydin anası olub. İbn Şəbəh isnadı ilə Sabit əl-

---

[1609] əl-Mufid, "əl-Məsəil əs-Səraviyyə", səh: 86-87;

[1610] "Sahih əl-Buxari", 2725;

[1611] İbn Əbi Şeybə, "əl-Musannəf", 7/472 (37325)

Bunani'dən, o da Ənəs bin Malik'dən rəvayət edir: "Bir gün Ömər gecə vaxtı Mədinədə (küçələri) gəzib yoxlama edərkən onun sahələrindən birindən keçdi; bu zaman orada heyvan tükündən bir çadır gördü, bir gecə əvvəl o çadır orada yox idi. Ona yaxınlaşdı, bir qadın iniltisini eşitdi və bir kişinin oturduğunu gördü. Ona yaxınlaşdı, ona salam verdi və dedi: "Kimsən sən?" Dedi: "Mən bədəvilərdən biriyəm, möminlərin əmirinin yanına gəlmişəm ki, onun verdiklərindən mənə də bir pay düşsün." (Ömər) dedi: "Bəs bu evdən eşitdiyim səs-küy nədir?" (Kişi) dedi: "Allah sənə rəhmət etsin! Get öz işin-gücünlə məşğul ol!" Dedi: "O mənlikdir! Nəyin səsidir?" Dedi: "Doğuş sancıları tutmuş bir qadındır." Dedi: "Yanında kimsə varmı?" Dedi: "Xeyr." (Ömər) getdi və evinə gəlib həyat yoldaşı Əlinin qızı Ummu Kulsum'a dedi: "Sənə Allahın gətirdiyi bir savabdan xəbər verimmi?" (O) dedi: "Nədir o?" (Ömər) dedi: "Qərib bir qadın doğur və onun yanında heç kim yoxdur." (O) dedi: "Əgər sən istəsən, bəli, (gedərəm)." (Ömər) dedi: "Doğacaq qadına lazım olan parça, yağ və sair şeyləri götür və mənə də bir qazan, yağ və dənli məhsullar gətir."(O) bunları gətirdi. (Ömər) dedi: "Gəl, yola çıxaq." Qazanı (Ömər) götürdü, Ümmü Külsüm də onun arxasınca getdi. Onlar çadıra çatdılar. Ömər ona dedi: "Qadının yanına gir." Özü isə həmin kişinin yanında oturdu və dedi: "Mənim üçün bir od qala." (Kişi) od qaladı. Ömər qazanın altını yandırdı və yeməyi bişirdi. Qadın isə doğdu. (Ömərin) zövcəsi dedi: "Ey möminlərin əmiri! Yoldaşını bir oğulla müjdələ!" "Ey möminlərin əmiri" sözünü eşidən kişi sanki ondan qorxdu və geri çəkilməyə başladı. (Ömər) dedi: "Olduğun yerdə qal!" Sonra Ömər qazanın içindəkini götürüb çadırın qapısına qoydu və (Ummu Kulsum'a) dedi: "Qadını doyur!" (O, qadını yedizdirdi), sonra qazanı çıxarıb qapıya qoydu. Ömər onu götürüb kişinin qarşısına qoydu və dedi: "Ye, vay halına! Axı sən gecəni oyaq qalmısan." Kişi (dediyini) etdi. Sonra Ömər həyat yoldaşına dedi: "İndi çölə çıxa bilərsən." Kişiyə isə dedi: "Sabah bizim yanımıza gəl, sənin işini yoluna qoyaq." Səhəri gün kişi gəldi və Ömər ona ehtiyacı olan yardımı etdi və onu təmin etdi."[1612] Bu və daha əvvəl təqdim etdiyimiz rəvayətlərin heç birinin isnadında əz-Zubeyr bin Bəkkər'in adı keçmir. Ümumiyyətlə bu evliliyin xəbərləri kitablara yazılarkən əz-Zubeyr bin Bəkkər hələ dünyaya göz açmamışdı. Yaxşı ki, əl-Mufid'in bu sözlərinə şiə alimləri özləri cavab veriblər. Bu cavablar əsasən iki nöqtədə durur; bunlardan biri əz-Zubeyr bin Bəkkər ilə bağlıdır, digəri isə bu evlilik xəbərinin gəldiyi rəvayət yollarının

[1612] İbnul-Cəvzi, "Mənaqibu Ömər", səh: 353-354;

mütəvatir həddinə çatması ilə əlaqəlidir. Hamıdan əvvəl əl-Feyd əl-Kəşəni'nin cavabını təqdim etmək istəyirəm, çünki o, cavabında hər iki nöqtədən əl-Mufidin xəta etdiyini göstərir. Beləki o, yazır: "Lakin doğru olan budur ki, əz-Zubeyr bin Bəkkər həmin zamana yaxın bir vaxtda yaşadığı üçün və həmin hadisələri bilən kəslərin gözü qarşısında bunları yazdığı üçün onun rəvayəti mütəvatir həddinə aid edilməlidir, çünki Əlinin - əleyhissələm - öz qızını əsrin xəlifəsinə ərə verməsi gizli olacaq bir iş deyildi ki, bunun üstündən yüz il keçdikdən sonra unudulsun. Məkkənin qazisi olmuş, öz zamanında və ondan sonra nəsəb elmi ilə tanınmış əz-Zubeyr bin Bəkkər kimi elmə və etibarlılığa iddiaalı olan birinin nəql etdiyinin doğru olması labüddür. Üstəlik "əl-İstiyab" və "əl-İsabə" kitabındakılara əsasən bu hadisəni ondan başqaları da, misal üçün Əbu Bişr əd-Dəvləbi, İbn Sad və İbn Vəhb kimiləri rəvayət ediblər və onların yalan üzərində ittifaq etmiş olmaqları adətin hökmü ilə imkansızdır. Bizim hədislərimizdə varid olanlar da bunu dəstəkləyir."[1613] Burada əl-Kəşəni'nin sözünə dəstək olaraq onu da əlavə etmək olar ki, əz-Zubeyr bin Bəkkər tarixən etibarlı və dəqiq bir alim kimi tanınıb, nəsəb sahəsində ona bərabər tutulacaq az bir kimsə tapıla bilər. O, həm sünni alimlərinin, həm də şiə alimlərinin yanında bu məsələlərdə avtoritet kimi qəbul edilir. Misal üçün bir yerdə şiə ricəl alimlərindən İbn İdris əl-Hilli (vəfatı h. 598) Əli əl-Əsğar'ın Kərbəla qətliamında öldürüldüyünü deyən əl-Mufid'in sözünün[1614] xəta olduğunu göstərmək üçün deyir: "Bu kimi məsələlərdə ən doğru olan ixtisas əhlinə müraciət etməkdir və onlar nəsəb alimləri, sira, xəbər və tarix əshabıdır. Misal üçün əz-Zubeyr bin Bəkkər'in "Ənsəb Qureyş" kitabında…"[1615] Beləliklə də əz-Zubeyr bin Bəkkər bu kimi mövzularda əl-Mufidin xətasını göstərmək üçün kifayət qədər etibarlı qəbul edilən bir alimdir. Onun haqqında əl-Mufid'in və başqalarının dedikləri, yalanlardan başqa bir şey deyildir, çünki əz-Zubeyr bin Bəkkər heç bir şəkildə əhlul-beytə qarşı düşmənçilik etməyib. O əhlul-beyt ilə yaxından qohumluq əlaqələri olan bir ailədən gəlir və kitablarında Əlinin fəziləti barəsində rəvayət etdikləri onun Əliyə olan sevgisinə dəlalət edir. Xüsusilə ikinci nöqtəyə gəldikdə isə bu barədə onun ən məşhur tələbəsi əş-Şərif əl-Murtəda belə deyir: "Əshabımızdan qafil olan kəslərdən bu

---

[1613] əl-Kəşəni, "əl-Vafi", 21/109;

[1614] əl-Mufid'in bu cür deməsinin səbəbi bir imamdan sonra onun ən böyük oğlunun imam olması fikri ilə uyğunluq sağlamaq olub.

[1615] İbn İdris, "əs-Sərair", 1/655;

evliliyin baş verməsini inkar edənlərə[1616] gəldikdə isə, şübhəsiz ki, bu evliliyin baş verməsi, bu ailənin (xəbərlərinin) nəqli və onun (yəni Ummu Kulsum'un) Ömərdən uşaqlar dünyaya gətirməsi məlumdur, məşhurdur və bunu bir cahildən və inadkardan başqasının inkar etməsi mümkün deyildir. Dində sağlam bir izahı olduğu halda zəruri olaraq bilinənləri, gözlə görünənləri inkar etməyə nə ehtiyac var ki?!"[1617] Qəribə deyildir ki, şeyxi əl-Mufid'dən fərqli olaraq tələbələri Əbus-Saləh əl-Hələbi və Şeyxut-Taifə ət-Tusi evliliyin baş verdiyini təsdiq edirlər.[1618] Şiə alimlərindən Muhəmməd Təqi ət-Tustəri yazır: "Bu evliliyi heç bir mühəqqiq alim təhqiq məqamında inkar etməyib, Ömərin onunla evlənməsi, onun iddət gözləməsi haqqında sünnilərin rəvayət etdiyi xəbərlər, sira kitablarının ittifaqı bir kənarda qalsın, bizim öz xəbərlərimiz bu barədə mütəvatirdir."[1619] Muhəmməd əl-Hüseyn ət-Tehrani isə yazır: "Ömər bin əl-Xattab'ın əs-Siddiqa əl-Kubra'nın (yəni Fatimənin) - sələmullahi aleyhə - qızı Ummu Kulsum ilə evlənməsi müsəlləm olan tarixi hadisələrdəndir. Bəzi şiələr nə üçün bunu bəzi kitablarda inkar etməyə çalışırlar?!..."[1620] Abdunnəbi əl-Kazimi evliliyin baş verməsi rəyi haqqında deyir ki, "bu, ən səhih olandır, çünki (bu barədəki xəbərlər) müstəfiddir."[1621] Xəbərlərin müstəfid olması isə o deməkdir ki, bu xəbərlər mütəvatir hökmündə olmasa da ona yaxındır. Xəbərlər əslində mənəvi mütəvatir dərəcəsindədir və ət-Tustəri'nin bu barədəki şahidliyi ilə tanış olduq. Süleyman əl-Məhuzi də əl-Mufid'in mövqeyini qeyd etdikdən sonra deyir: "Bunun (haqdan) uzaqlığı aşkardır, bizim (bu barədəki) xəbərlərimiz bunu (yəni əl-Mufidin rəyini) haqlı olaraq rədd edir."[1622] əl-Məhuzi'nin şeyxi əl-Məclisi yazır: "Eynilə əl-Mufid'in bu hadisənin əslən baş verdiyini inkar etməsi də sadəcə olaraq bunun onların (sünnilərin) rəvayət yolları ilə sabit olmadığını göstərmək üçündür, yoxsa bu xəbərlərdən, Ömər öldükdə Əlinin Ummu Kulsumu götürüb evinə aparması haqqında isnadları ilə qeyd edəcəklərimizdən və "Bihər əl-Ənvar" kitabında gətirdiklərimizdən

---

[1616] Bununla şeyxi əl-Mufid'i qəsd etdiyi dəqiq deyildir.

[1617] "Rasəil əş-Şərif əl-Murtəda", 3/150;

[1618] Bax: əl-Hələbi, "Təqribul-Məarif", səh: 224; ət-Tusi, "əl-İqtisad fil-İtiqad", səh: 213-214; "Təmhid əl-Usul", səh: 386-387;

[1619] ət-Tustəri, "Qamus ər-Ricəl", 12/216;

[1620] ət-Tehrani, "Mərifətul-İməm", 15/258;

[1621] əl-Kazimi, "Təkmilətur-Ricəl", 2/698;

[1622] "Zəxiratul-Məhşər", əlyazma (q. 30/ə) Bunu Yusuf əl-Bəhrani "Sələsil əl-Hədid" kitabında (1/297) ondan nəql edib.

sonra bunu inkar etmək çox təəccüblüdür."[1623] Həmçinin Abdullah bin Saleh əs-Səməhici də onun sözlərini rədd edərək buyurur: "Amma bizim etibarlı qaynaq kitablarımızda varid olmuş səhih hədislərdən sonra Şeyx Muhəmməd bin Muhəmməd bin ən-Numən əl-Mufid'in evliliyin əslini inkar etməsinə gəldikdə isə bunun heç bir yeri yoxdur; burada yeganə yol (nəzəri olaraq) bunu imkansız görmək və nassın qarşısına ictihad qoymaq ola bilər ki, bu da insaf və düzgünlük yolundan kənara çıxmaqdır, halbuki bu, əhəd hədis damğasından ötəyə keçmiş məşhur bir hadisədir."[1624] Muhəmməd Asif Muhsini də yazır ki, "şeyximiz əl-Mufid'in xəbərin səhihliyini inkar etməsinə gəldikdə sanki işarə etdiyimiz o üç rəvayətdən qəflətdə olub."[1625] Əlbəttə ki, əl-Mufid kimi bir alim bu xəbərlərdən qəflətdə olmayıb, lakin əl-Mufid "əs-Səraviyyə" suallarına cavab verərkən bu evliliyi inkar etmək onun üçün ən asan bir variant olub. Çünki əl-Mufid başqa kitablarında bu evliliyi inkar etmir, əksinə baş verdiyini təsdiqləyir, sadəcə olaraq digər şiə alimləri kimi buna fərqli bir izah verməyə çalışır. Muhəmməd Həsun deyir ki: 'Ümmü Külsumun Ömər bin əl-Xattabla evlənməsi məsələsi İslam tarixində müzakirə olunan mühüm məsələlərdən biridir. Bu mövzu geniş müzakirə olunub və bu gün də davam edir, çünki o, mühüm bir əqidə məsələsinə, yəni imamət məsələsinə toxunur. Bu evliliyin baş verdiyini və düzgün olduğunu iddia edənlər bunu Ömərin dürüstlüyü və İmam Əlinin bunu etiraf etməsi üçün dəlil kimi gətirirlər. Əks təqdirdə, Əli qızını ona necə ərə verərdi?! Digər tərəfdən, bu evliliyi inkar edənlər və ya bunun Ömər tərəfindən İmam Əliyə edilən təzyiq nəticəsində baş verdiyini iddia edənlər bunu Ömər bin əl-Xattabın düzgün və dürüst biri olmadığına və Əlinin onu belə etiraf etmədiyinə dair dəlil gətirirlər."[1626] Muhəmməd Cəmil Həmud bildirir ki, bu evlilik "əgər baş veribsə, zamanla möminlərin əqidəsinin sarsılmasına səbəb olar."[1627] O burada "möminlərin əqidəsi" ilə səhabələr və əhlulbeyt arasında düşmənçiliyin olması fikri üzərində qurulmuş təsəvvürləri nəzərdə tutur. Nəcəh əl-Tai deyir: "Ömərin Ümmü Külsumla evlənməsi məsələsində aydın və bəlli olan odur ki, əməvilər Ömərə yeni bir fəzilət qazandırmaq istəyirdilər, bu da Fatimənin və Əlinin qızı ilə evlənməsini önə çıxararaq Əhli-beytə edilən

---

[1623] əl-Məclisi, "Mirətul-Uqul", 20/45;

[1624] Bunu ondan əl-Bəhrani "Sələsil əl-Hudud" kitabında (1/300) nəql edir.

[1625] Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 2/125;

[1626] Həsun, "Aləm ən-Nisə əl-Muminət", səh: 213;

[1627] Həmud, "İfhəm əl-Fuhul", səh: 52;

zülmü ört-basdır etmək idi.” O həmçinin deyib: “Bu xəbərin ravisi Ömərə yeni bir fəzilət əlavə etmək niyyətində olub, bu da onun Fatimənin və İmam Əlinin qızı ilə evlənməsini vurğulayaraq Fatimə Zəhranı öldürməsini, oğlu Muhsini öldürməsini, həmçinin Ömərin xilafəti Əlidən qoparıb zorla ələ keçirməsini və Əlini dini və siyasi rəhbərlikdən kənarlaşdırmasını gizlətməyi qəsd edirdi. Əməvilərin istədiyi daha bir əhəmiyyətli fəzilət Ömərin Peyğəmbərin nəvəsi ilə evlənməsi idi.”[1628] O həmçinin dedi: “Fatimənin qabırğasını qırmış, qapısını yandırmış və onun ölümünə səbəb olmuş Ömər ilə öz qızını İmam Əlinin evləndirəcəyini bir insan necə təsəvvür edə bilər?!”[1629] Əziz oxucu, Əli ilə Ömər arasında baş vermiş bu qohumluq bağı ilə bəzi yalan nəzəriyyələrin və böhtanların arasındakı bu uyğunsuzluğun olduğunu görmək çətin olmamalıdır. Buna görə də, bəziləri bu mübarək evliliyin əhəmiyyətini azaltmağa çalışıblar, ya onu əqidəvi əhəmiyyətindən məhrum etmək, ya da Ömərlə belə bir evliliyə zərurət donu geyindirmək üçün bəhanələr uydurmağa çalışıblar.

Bu cəhdlərdən biri və bəlkə də ən gülməlisi budur ki, iddiaya görə Əlinin Ömərə ərə verdiyi qız öz doğma qızı yox, cin nəslindən olan yəhudi bir qız olub. Bu barədə gəlmiş rəvayəti zikr edərək kitabımızı mənasız sətrlərlə doldurmaq istəmirik. Lakin bu barədə azca araşdırma etməyi bacaran şəxs həmin rəvayətlə qarşılaşacaq. Bu rəvayəti ilk dəfə ortaya çıxaran şəxs Əbu Muhəmməd əl-Həsən bin əl-Qasim bin Muhəmməd əl-Avid əl-Ələvi olub.[1630] Çox təəssüf ki, bu xurafata inanan şiə alimlər var.[1631] Şübhəsiz ki, Ömərin evləndiyi qızın əslində Əlinin qızı yox, bir cin olması barəsində şiə kitablarında keçən rəvayətə gəldikdə isə bu, sonradan uydurulmuş bir xəbərdir. əl-Feyd əl-Kəşəni yazır: “Müəllifin Nəcran əhlindən olan yəhudi bir cinli qız hədisi ilə bağlı rəvayət etdiyinə gəldikdə isə bu, bir qrup məchul ravidən gəlir və belə bir izaha ümumiyyətlə ehtiyac yoxdur. Belə bir hekayəni uydurub onu nəql etməyə nə ehtiyac olduğunu bilmirik… Bu xəbəri uyduran kəs Əlini - əleyhissələm - digər sıradan kişilər ilə müqayisə edib, ona görə də uşağını itirmiş bir qadını belə güldürəcək həddə çatan bu xurafatı

---

[1628] ət-Tai, “Təhrif Əsma Əvləd əl-Məsumin”, səh: 121-123;

[1629] Eyni mənbə, səh: 126;

[1630] “əl-Məcdi fi Ənsəb ət-Talibin”, səh: 199;

[1631] Muhəmməd Cəmil Həmud “İfhəmul-Fuhul” kitabında, Muhəmməd Baqir əl-Musəvi “əl-Kəvsər” kitabında bu rəvayəti müdafiə edirlər. Qəribədir ki, Cəfər Murtəda əl-Amili bu rəvayətin isnadının zəif və məchul olduğunu təsdiqlədikdən sonra mətninin mümkün ola biləcəyini iddia edir. Zahirən də xurafat olduğu aşkar görünən bir xəbərin sənədinin batil olduğunu bildikdən sonra mətnini müdafiə etməyə nə ehtiyac var?!

uydurub. Sənədində bir-birindən rəvayət edən bu ravilər uydurulmuş adlardan başqa bir şey deyildir, onlar heç zaman real həyatda mövcud olmayıblar."[1632] əl-Kəşəni görünür ki, bu barədə əş-Şərif əl-Murtəda'nın dedikləri ilə tanış idi, çünki əş-Şərif əl-Murtəda da buna yaxın ibarə ilə bu absurd rəvayəti rədd edir və deyir: "Bizim əshabımızdan cahillərin bu əqdin baş verdiyini, lakin cinsi yaxınlıq məqamında Allahın həmin qızı bir şeytan ilə əvəz etdiyini deməklərinə gəldikdə isə bu, uşağı ölmüş qadını belə güldürəcək bir şeydir."[1633] Ona görə də əl-Məclisi'nin bu hekayəni "Bihər əl-Ənvar" kitabında gətirdiyini görən Şeyx Muhəmməd Asif əl-Muhsini onu buna görə tənqid edir və deyir: "Bu rəvayəti və bunun əmsalını müəllif kimi bir alimin öz kitabında nəql etməsi və onu qəbul etməsi təəccüblüdür və qəribədir. Bu, mühəddislərin sadəlövhlüyünü göstərir, yoxsa əks təqdirdə bu cür rəvayətlərin nəql edilməsinin məzhəbi zəiflətdiyini, Əhlul-Beytin hədislərinə olan etimadı azaltdığını və onları əqlə zidd hala gətirdiyini anlayardılar. Çox təəssüf ki, bu rəvayətin və bənzərlərinin içindəkilər, xətiblərin və yazıçıların səyi ilə, xalq arasında - əsasən əl-Məclisi'nin və onun "Bihər əl-Ənvar" kitabının statusuna aldandıqları üçün - məzhəb təfəkkürünə çevrilib."[1634] Həqiqətən də məsələ əl-Muhsini'nin dediyi kimidir; əl-Məclisi'nin kitabındakı xurafatlar sayəsində şiələr arasında bu cür hekayələrə inanmaq, onları hekayət süfrələrinə düzmək bir adət olub. Lakin çox qəribədir ki, avam kütlənin yanında dəli fantaziyaların məhsulu olan bu cür hekayələri danışdıqda vəcdə gəlirlər, feyzyab olurlar. Bizim onlardan gözləntimiz bu cür xurafatları rədd etmək olduğu halda onlar hekayətlərdəki xurafat ünsürünü nə qədər dəlisovdursa o qədər daha şiddətlə buna inanırlar.

Şiələrdən bəziləri isə iddia edir ki, Ömər ilə Ummu Kulsum evlənmiş olsalar da Ömər onunla yaxınlıq etməyib. Bunu iddia edənlər sanki Ömərin bu evliliyi ömrünün axırında etdiyinə və Ummu Kulsum ilə ailə həyatı yaşamağa imkan tapmadan əvvəl öldüyünə inanırlar. Bu iddianı şiələr arasında ilk səsləndirən Əbu Muhəmməd ən-Növbəxti olub.[1635] Müasirlərdən bunu təsdiqləyənlər arasında Cəfər Murtəda əl-Amili də var.[1636] Bu iddia əvvəlki kimi absurd olmasa da tarixdən

---

[1632] əl-Kəşəni, "əl-Vafi", 21/107-108;

[1633] "Risalətu İnkəh Əmir əl-Muminin", səh: 31; Onun bu risaləsini, xüsusilə bu sözlərini İbnul-Cəvzi "əl-Muntəzam" kitabında (15/299) nəql edir.

[1634] əl-Muhsini, "Məşraatu Bihər əl-Ənvar", 2/125;

[1635] İbn Şəhri Əşub, "Mənaqib Al Əbi Talib", 3/89;

[1636] əl-Amili, "Zuləmətu Ummu Kulsum", səh: 88;

məlum olanlara ziddir. əş-Şərif əl-Murtəda özü şahidlik etdi ki, Ömərin Ummu Kulsum ilə evlənməsi və ondan övladlarının dünyaya gəlməsi tarixən zəruri olaraq bilinən bir məsələdir və bunu ya cahil, ya da inadkar birindən başqa heç kim inkar etməz. Aydındır ki, bunu inkar edənləri bunu etməyə sövq edən səbəb belə bir şeyin onların nəfsinə ağır gəlməsidir. əş-Şərif əl-Murtəda həmçinin izah edir ki, bu evlilikdəki problem cinsəl yaxınlıqda yox, evlilik əqdinin bağlanmasının özündədir. O deyir: “Cahil tərəfdarlarımızdan bəziləri deyirlər ki, müqavilə bağlanıb, lakin yaxınlıq etmək məqamında Allah ərə verilmiş qadını şeytanla əvəz etdi; bu, uşağını itirmiş bir qadının belə gülməsinə səbəb olar. Məsələ, cinsi yaxınlığın olub olmamasından asılı olmayaraq, kafirlə bağlanan evlilik müqaviləsinin özündədir. Kafirlə mömin arasında evliliyin baş tutmaması üçün gətirilən üzr elə məhz budur və cinsəl yaxınlıqdan məhrum etməyi qeyd etməyin burada mənası yoxdur və evlənilməyə icazə verilməyən biri ilə evlilik müqaviləsi necə bağlamaq olar?!”[1637]

Şiə alimləri içində yayğın olan izahlardan biri də budur ki, Əli öz qızını məcbur olaraq Ömərə vermişdi. Onlar belə bir evliliyin haram olduğunu, lakin zərurətlərin haramları mübah etdiyini deyirlər. Bu fikri ilk səsləndirən Əbul-Qasim əl-Kufi olub, bunu “əl-İstiğasə” kitabında geniş bir şəkildə sübut etməyə çalışır. Əbus-Saləh əl-Hələbi isə qeyd edir ki, Ömərin halı münafiq olan Abdullah bin Əbis-Səlul’dan fərqlənmir.[1638] Bir çox şiə alimi yazır ki, Ömər batinən kafir olsa da, zahirən müsəlman idi və zahirən müsəlman olana qız vermək olar. Burada onlara görə ən böyük problem belə bir evliliyin məkruh olmasıdır ki, təhdidlər altında bu məkruhluq aradan qalxır, çünki Əli qızını ərə verməyə məcbur edilmişdi. Şeyxut-Taifə ət-Tusi deyir ki, Əli “qızını təqiyyə olaraq ona ərə verib… kim üzdə şəhadəti təsdiqləyərsə, İslamın zahirinə əməl edərsə ona ərə getmək icazəlidir…”[1639] əş-Şərif əl-Murtəda deyir: “Qızını ərə verməyə gəldikdə isə Əli bunu öz seçimi ilə etməyib, bu barədəki fikir ayrılığı məşhurdur. Beləki rəvayətə görə, Ömər möminlərin əmirinin - əleyhissələm - qızına elçi düşüb, amma o, imtina edib və məsələni uzadıb. Ömər sonra Abbasın yanına gəlib və ona deyib: “Yoxsa məndə bir problemmi var?” Abbas ona soruşdu: “Nə üçün belə deyirsən?” Ömər cavab verdi: 'Mən qardaşının oğluna elçi düşdüm, amma o, məni düşmənçiliyinə görə rədd etdi. Allaha and

[1637] İbn əl-Cəvzi, “əl-Muntəzam”, 15/299;

[1638] əl-Hələbi, “Təqrib əl-Məarif”, səh: 224;

[1639] ət-Tusi, “əl-İqtisad”, səh: 213;

olsun ki, Zəmzəm quyusunu dolduracağam, su mənbəyini dağıdacağam və sizin üçün—Bəni Haşim—bir dənə də olsun nailiyyət qoymayacağam ki, onu məhv etməyim. Mən ona qarşı oğurluq ittihamı ilə şahidlər gətirəcəyəm və onun əlini kəsəcəyəm.” Bundan sonra Abbas möminlərin əmirinin - aleyhissələm - yanına gedib, Ömərin nə dediyini ona çatdırdı. Möminlərin əmiri - əleyhissələm - isə dedi: “Mən and içmişəm ki, onu ona ərə verməyəcəm” Abbas dedi: “Bu işi mənim ixtiyarıma ver,” o da etdi və Abbas onu Ömərə ərə verdi. Əbu Abdullah Cəfər ibn Məhəmməddən - onların hər ikisinə salam olsun - rəvayət olunan “Bu, bizdən zorla alınmış bir övrət idi” sözləri də izah edir ki, bu, basqı və məcburiyyət altında baş vermişdi. Hadisə izah edildiyi şəkildə baş verməsəydi belə, Əlinin - əleyhissələm – (qızını) ona ərə verməsi imkansız olmazdı, çünki Ömər zahirən müsəlman idi, Islamın qanunlarına riayət edirdi və zahirən İslamın nümayişi şəriətə görə etibarlıdır. Bu, ağlın qadağan etdiyi bir şey deyildir.”[1640] Şeyx əl-Mufid daha əvvəl ondan təqdim etdiyimiz sözlərində bu evliliyin baş verdiyini inkar etdikdən sonra deyir: “Üstəlik əgər bu (evlilik) doğru olsa belə, bu vəziyyətin, möminlərin əmirindən - əleyhissəlam - əvvəlkilərin (yəni üç xəlifənin) zəlaləti barədə Şiə inancı ilə ziddiyyət təşkil etməyən iki izahı ola bilər: Birinci izah ondan ibarətdir ki, nikah zahirdə müsəlman olmaqla keçərlidir və bu, iki şəhadət kəliməsinin təsdiqi, Kəbəyə namaz qılmaq və şəriətin əsaslarına riayət etməkdir. Doğru imana etiqad edən biri ilə evlənmək, zahirdə müsəlman olan, lakin müsəlmanlığına sahibini dindən çıxarmayacaq bir zəlalət qatmış kimsə ilə evlənməmək daha əfzəl olsa da, İslam kəliməsini izhar edən zəlalət əhli ilə evlənməyi tələb edən səbəb zərurətdirsə, buradakı məkruhluq aradan qalxar və seçim haqqı olduqda müstəhəb olmayan şeylər icazəli olar. Möminlərin əmiri - əleyhissələm - birliyi qorumağa və qan tökülməsinin qarşısını almağa ehtiyac duyurdu. O düşündü ki, əgər Ömərin onun qızı ilə evlənmək arzusunu rədd etsə, bu, din və dünyada fəsada səbəb olacaq. Ancaq müsbət cavab versə, hər iki sahədə yaxşı nəticələr hasil olacaq. Buna görə də qeyd etdiyimiz səbəblərə görə bu istəyini qəbul etdi. İkinci izah isə ondan ibarətdir ki, zəlalət sahibi ilə evlənmək - məsələn, İmaməti inkar edən və ya ona layiq olmayan birinə iddia edən biri ilə evlənmək - haramdır, yalnız insan öz dinindən və canından qorxarsa, bu icazəli olur. Necə ki, imana zidd olan küfr sözlərini söyləmək və ya ölü heyvan ətini, qanı və donuz ətini yemək seçim halında qadağan olsa da zərurət halında icazəli olur. Möminlərin əmiri - əleyhissələm -

[1640] əş-Şərif əl-Murtəda, “əş-Şəfi fil-İməmə”, 3/272-273;

qızını Ömərlə evləndirməyə məcbur olmuşdu, çünki ona təhdid edilirdi. O, özünü və şiələrini təhlükədən qorumaq üçün buna məcbur idi və biz deyirik ki, zərurət küfr sözlərini söyləməyə icazə verdiyi kimi buna da icazə verir."[1641] Bu cavablardan anlaşılan məna budur ki, Ömər zahirən müsəlman olduğu üçün Əlinin öz qızını ona ərə verməsində bir problem yox idi. Bəziləri bu evliliyin məkruh olduğunu, digərləri isə haram olduğunu deyirlər, lakin zərurət altında məkruhluq və ya haramlıq aradan qalxmış olur. Buradan aydın olur ki, bu alimlərə görə Ömər zahirən müsəlman sayılırdı. Onların bu cavabı əslində şiələrin ən təməl etiqadi əsasları ilə uyğun gəlmir, çünki onların ittifaq etdikləri bir məsələ budur ki, Ömər hələ peyğəmbərin sağlığında onun Əlini xəlifə təyin etdiyini eşitmiş, bunu anlamış, Əliyə beyət etmiş, lakin peyğəmbərin - aleyhissalətu vassələm - vəfatından sonra ona xəyanət etmişdir. Bu isə məqsədli şəkildə müxalif olmaqdır və qəsdən dinin əsaslarından bir əsası inkar etməkdir. Üstəlik Ömər - şiələrin iddiasına görə - nəinki imaməti inkar etmişdir, hətta Əliyə və onun evinə hücum etmiş, Peyğəmbərin - aleyhissələm - məsum qızını qapı arasında qoymuş, onu yaralamış və nəticə etibarı ilə şəhid etmişdir. Həmçinin Əliyə qılınc qaldırmış, onu təhdid etmiş və Əbu Bəkrə beyət etməyə məcbur etmişdir. Bütün bunlardan sonra Ömər necə zahirən müsəlman ola bilər ki?! Ona görə də şiələrin bir çox alimi əl-Mufid və onun tələbələrinin verdikləri cavabla qane olmayıblar. Nemətullah əl-Cəzəiri misal üçün məsələyə toxunur və yazır: "Amma Ömərin xəlifəliyi vaxtı Əlinin öz qızı Ümmü Külsümü ona ərə verməsində ona görə işkəl vardır ki, çünki o zaman o, artıq günahlar etmiş və dindən, hər mürtəddən daha ağır bir şəkildə irtidad etmişdi. Hətta şiələrin rəvayətlərində nəql olunur ki, şeytan Cəhənnəmin dəmirindən olan yetmiş zəncirlə zəncirlənərək məhşərə sürüklənəcəkdir. Orada o, qarşısında əzab mələkləri tərəfindən, boynunda Cəhənnəmin yüz iyirmi zəncirindən ibarət zəncirlə aparılan bir adam görəcək. Şeytan ona yaxınlaşıb soruşacaq: "Bu bədbəxt nə etdi ki, mənim cəzamdan daha ağır cəzaya layiq görüldü, halbuki mən məxluqatı azdırdım və onları məhvə gətirdim?" Ömər isə şeytana cavab verəcək: "Mən heç nə etmədim, yalnız Əli ibn Əbu Talibin xilafətini qəsb etdim." Görünür ki, o, bədbəxtliyinin səbəbini və cəzasının artmasını az hesab etdi və başa düşmədi ki, bu hərəkətindən dünyada Qiyamət gününə qədər baş verən bütün küfr, nifaq və zülmkarların və zalımların hakimiyyəti məhz onun bu hərəkətindən qaynaqlanır… Əgər o, belə bir şəkildə dindən çıxaraq

[1641] əl-Mufid, "əl-Məsəil əs-Səraviyyə", səh: 90-92;

mürtəd olubsa, o zaman Allah kafirlərlə və mürtədlərlə evlənməyi - şiə alimlərinin ittifaqı ilə - qadağan etdiyi halda Şəriət onunla evlənməyə necə icazə verə bilərdi?! Biz bu məsələyə iki izah veririk, biri ümumi, digəri isə xüsusi. Birincisi, onların (şiələrin) rəvayətlərində əs-Sadiqdən nəql olunur ki, o, bu evlilik haqqında soruşulduqda, "Bu, bizdən zorla alınmış ilk övrətdir" deyə cavab vermişdir. Bunun izahı budur ki, xilafət, möminlərin əmiri üçün uşaqlar, qızlar, arvadlar və sərvətdən daha qiymətli idi, çünki onunla din ayaqda durur, sünnət tamamlanır, zülm aradan qaldırılır, haqq dirçəlir və dünyanın və axirətin faydaları əldə edilir. Əgər o, uğrunda canlar qurban verib qanlar tökməsinə, hətta Siffin döyüşündə altmış min adam öldürməsinə, öz ordusundan iyirmi min adam qurban verməsinə baxmayaraq - Muaviyə dövründə də imaməti qorumaq mümkün olmamışdı, və Kərbəla hadisəsi qeyd olunmağa ehtiyac olmayacaq dərəcədə məşhurdur - bu böyük işi müdafiə edə bilmədisə, o zaman biz bu böyük işi tərk etməkdə onun üzrünü qəbul etsək, o həqiqətən da üzrlü olur. Təqiyyə Allahın bəndələri üçün açdığı bir qapıdır və o, onlara bunu tətbiq etməyi əmr etmişdir, namaz və oruc kimi bunu onlara vacib etmişdir, belə ki, pak İmamlardan belə bir rəvayət gəlib: "Təqiyyəsi olmayanın dini yoxdur." Beləliklə, onun bu cüzi işdə üzrü qəbul edilməlidir. Çünki, Əl-Kuleyni, İbn Əbi Umeyrdən, o isə Hişəm bin Səlim'dən, o da Əbu Abdilləhdən nəql edir: Ömər evlənmək təklif edəndə, möminlərin əmiri ona, "O, hələ kiçikdir" dedi. Ömər Abbasın yanına gedərək ona dedi: "Mənim nə qüsurum var?" Abbas ondan - "Nə məsələdir?" deyə soruşdu. Ömər cavab verdi: "Mən qardaşının qızına evlənmək təklif etdim və o, məni rədd etdi. Vallahi, mən Zəmzəmi dolduracağam və sizin üçün olan bütün şərəfi məhv edəcəyəm və iki şahid gətirib onu oğurluqda ittiham edəcəyəm və onun əlini kəsəcəyəm." Abbas Əlinin yanına gedib ona Ömərin dediklərini bildirdi və işi ona həvalə etməsini xahiş etdi və o da etdi. Bu evlilikdə Ömərin zina etməsi ehtimalı ilə bağlı gələn etiraza gəlincə, bu, Ümmü Külsümə nəzərən əqlin qəbul edə bilməyəcəyi bir şeydir. Beləliklə də buna iki cavab verilə bilər." Burada biz əl-Cəzəiri'nin demək istədiyi ən önəmli yerə gəldik; gəlin bir yerdə görək əl-Cəzəiri bu önəmli nöqtə haqqında nə deyir: "Birincisi, Ümmü Külsüm bu məsələdə nə zahirən, nə də həqiqətən günahkar deyil və bu çox aşkar məsələdir. Ömərə gəldikdə isə, o, şəriətə görə zahirən zinakar sayılmır, çünki yaxınlıq qanuni vəli tərəfindən icazə verilmiş bir nikah müqaviləsi əsasında baş vermişdir. Lakin həqiqətdə və əslində o, nəinki zinakarın cəzasını, hətta bütün günahkar və pis insanların

cəzasını çəkəcəkdir…"[1642] Beləliklə də əl-Cəzəiri'yə görə Ömər şəriətin zahirinə görə zina etmiş sayılmasa da, həqiqətdə zina etmiş olur və buna görə Axirətdə ona zina cəzası veriləcək. Bu cavabın çirkinliyi ondadır ki, əl-Cəzəiri'nin sözünün mahiyyəti budur ki, Ömərin etdiyi zahirən zina olmasa da, işin həqiqətində və mahiyyətində zinadır. Başqa cür desək Ömərin peyğəmbərin - salləllahu aleyhi va səlləm - pak nəsəbini ləkələdiyini etiraf etmiş olur. Hətta Ummu Kulsum'u bu günahdan təmizə çıxarmaq, onun aid olduğu pak nəsəbi əl-Cəzəiri'nin sözlərindəki zina ittihamından qurtarmış olmur. "Mərifətul-İməm" kitabında isə belə bir izah keçməkdədir: "İmam Sadiqin (ə) "Bu, zorla əldən alınmış bir namus idi" sözünə gəlincə, bu doğrudur, yəni bu evlilik, formal mərasimlər və ənənəvi prosedurların yerinə yetirilmiş olmasına baxmayaraq atanın və qızın razılığı olmadan baş vermişdi. Lakin məcburiyyət altında edildiyi üçün həqiqi evliliyin hökmləri tətbiq edilmir. Ömərin əməli haram idi, amma Ümmü Külsümün əməli haram deyildi. Onun bu məsələ ilə bağlı əməli zina sayılmır və onun Ömərdən olan uşaqları halal övlad hesab edilir, çünki hər hansı bir əməl məcburiyyət altında yerinə yetirilərsə, İslamın müqəddəs şəriətində buna görə heç bir cəza və ya günah yoxdur. Eyni şəkildə, məcburiyyət altında qadınla cinsi əlaqədən doğulan uşaqlar halal övlad sayılır, necəki fiqh elmində təfsilatı zikr edilmiş şübhə ilə baş vermiş cinsi əlaqədən olan uşaqlar da belədir."[1643] Bu cavab əvvəlkindən də çirkindir, çünki Ummu Kulsumu zina adından, övladlarını haramlıqdan təmizə çıxarmaq problemi həll etmir, problem pak bir nəsəbi zina ilə, haram əlaqə ilə ləkələməkdir.

Muhəmməd Cəmil Həmmud əl-Amili "Ummu Kulsum'un iffətinin zorla pozulması" hekayəsini rədd edən və təkzib edən şiə alimlərindəndir. O, belə bir evliliyin şiə etiqadında nə təqiyyə, nə də məcburiyyət ilə izah edilə bilməyəcəyini anladığı üçün bu evliliyin baş verdiyini ümumiyyətlə kökündən inkar edir. Buna görə də o, "əhlul-beytdən olan bir qızın iffətinin zorla pozulması" fikrini rədd etmək üçün müxtəlif cavablar verir və deyir: "Çoxluğun iddia etdiyi kimi evliliyin baş verməsinə inanmaq hikmətə ziddir, çünki bu, Əhlul-Beyti münafiqlərin, zəiflərin və sadəlövhlərin gözündə kiçildir və onları sadəlövhlər, qorxaqlar və yaltaqlar sırasına qatır."[1644] O, həmçinin deyir: "Möminlərin əmiri (Əli) Ümmü Külsümü Ömərlə evləndirmək üçün

---

[1642] əl-Cəzəiri, "ən-Ənvar ən-Numəniyyə", 1/64-65;

[1643] ət-Tehrani, "Mərifətul-İməm", 15/274;

[1644] Həmmud, "İfhəm əl-Fuhul", səh: 18;

qızının ondan xoşu gəlmədiyini bəhanə edərək Ömərin evlilik tələbini rədd edə bilərdi, evliliyin ikrah altında edilməsi onu etibarsız edir və bu, Məhəmmədin şəriətinə görə icazəli deyil. Buna görə də Ömər evliliyə israr edə bilməzdi, çünki əgər bunu etsəydi, müsəlman kütlələrin qarşısında İmam üçün bir arqument olardı və Ömər müsəlmanların qarşısında açıq şəkildə Allahın və Rəsulunun iradəsinə qarşı çıxa bilməzdi."[1645] Cəmil Həmmud'un bu dediklərini təsdiqləyən nöqtələrdən biri də budur ki, o dövrdə xəlifələr istədiklərini edə biləcək dərəcədə mütləq hakimiyyətə sahib deyildilər və reallıq bu idi ki, onlar rəiyyə üzərində ədalətlə hökm edirdilər. Bunun bir misalı budur ki, xəlifə Ömər Peyğəmbərin – aleyhissalətu vassələm – məscidini genişləndirmək istədikdə onun qonşuluğundakı evləri alır. Lakin Peyğəmbərin əmisi Abbas'ın evini almağı təklif etdikdə Abbas onu satmaqdan imtina edir. Ömət hətta ona üç seçim verir; ya yaxşı pul qarşılığında evini satsın, ya onun müqabilində istədiyi bir yerdə onun üçün ev tikdirsin, ya da evini Allah rızası üçün müsəlmanlara sədəqə versin. Abbas bununla da razılaşmayanda Ömər ona aralarında hakim olaraq qərar verəcək bir kimsəni təyin etməyi təklif edir. Abbas hakim olaraq Ubeyy bin Kəb'i təklif edir və onun yanına gedirlər; Übeyy məsələyə baxır və xəlifəyə qarşı Abbasın haqqını qoruyur.[1646] Əgər xəlifə bu qədər despotik bir şəxsiyyət olubsa nə əcəb Abbasın əlindən evini ala bilməyib?! Cəfər əl-Murtada əl-Əmili'nin əl-Kafi'dən olan rəvayətə əsaslanaraq evliliyin məcburiyyət altında baş verdiyini bildirməsini ondan nəql etdikdən sonra Həmmud əl-Amili deyir: "Mən inanmıram ki, möminlərin əmiri, ins və cinin ağası (Əli) şəxsi maraqlar naminə öz şərəfini qurban verəcək qədər aşağı səviyyəyə enər. Mən də inanmıram ki, Ömərin təhdidi onun cəsarətini və dünya miqyasında misli olmayan qəhrəmanlıq mövqelərinə təsir edər. Necə ola bilər ki, oğurluq ittihamı kimi mənfi bir şöhrət onun, faydası bütün müsəlmanlar üçün Qiyamət gününə qədər davam edəcək böyük mövqelərini etibarsız etsin? Halbuki Yusif Peyğəmbərin qardaşları onu oğurluqda ittiham etdilər, lakin bu, onun mövqeyinə, istər gizlində, istərsə də aşkarda təsir etmədi."[1647] O, həmçinin Əlinin qızını Ömərə verdiyini onun oğurluq ittihamından qorxduğu üçün etməsi ilə izah edənləri tənqid edərək dedi: "İslam dünyamızda bir çox dini və siyasi

[1645] Eyni mənbə, səh: 48;

[1646] Bax: İbn Sad, "ət-Tabəqat əl-Kubra", 4/19-20; əl-Xanəci çapı; İbn Asəkir, "Tərixu Diməşq", 26/366-371;

[1647] Eyni mənbə, səh: 98;

şəxsiyyətlərə iftira atılıb, lakin insanlar buna inanmayıblar və ona əhəmiyyət verməyiblər. Əksinə, belə ittihamlar yalnız bu şəxsiyyətlərin qarşıya qoyduqları hədəflərə doğru irəliləməkdə israrlı olmaqlarına səbəb olub. Buna görə də belə bir ittihamın ona yapışdırılması Ömər bin əl-Xattab'ın istəklərinə boyun əyməyə əsas vermir."[1648] O, həmçinin qeyd edir: "İmam Əli Ömərin evlilik tələbindən hər hansı bir vasitə və ya üsulla qaça bildiyi üçün, təqiyyə və ya zərurətdən dolayı evlilik iddiası düzgün deyil."[1649] O, yenə buyurur: "(Xəbərdəki) "iğtisab" (zorla ələ almaq) elə onun və atasının iradəsinə qarşı çıxmaqdan başqa bir şey deyil və onlar bu səviyyədən çox yuxarıdırlar."[1650] O əlavə etdi: "Şəriət məsum İmama birisi onu oğurluq və ya əlinin kəsilməsi ilə təhdid edərsə, zina, lesbiyanlıq və ya sodomiyanı halal etməsinə icazə verirmi?"[1651]

Doktor Əli Saleh Rəsən əl-Muhəmmədəvi əl-Kuleyninin Cəfər əl-Sadiqdən rəvayət etdiyi yalançı "zorla isməti pozmaq" hekayəsini və Ömərin Əli və Abbası hədələməsi haqqındakı rəvayəti rədd edir. O, bu rəvayətin sənədini şübhə altına alır, onun mətnini tənqid edir, hətta ravilərii onu uydurmaqda ittiham edir. O, bu rəvayətin uydurma olduğunu açıq şəkildə bildirərək deyir: "Biz bir həqiqəti etiraf etməliyik ki, Əhli-Beyti sevən şiələr müəyyən rəvayətləri ortaya salıblar və onları şişirdiblər, bunu bəlkə də bilməyərəkdən, ya da onlara olan sevgilərini göstərmək məqsədi ilə ediblər. Lakin bununla əslində onlara zərər veriblər. Buna görə də Ömərin evliliyi məsələsini çürütmək əvəzinə ona cavab vermək məqsədilə bu rəvayətin uydurulmuş olmasını istisna etmirik, beləliklə də belə cavab vveriblər ki, guya Ömər onunla zorla evlənib və bununla da İmama hörmətsizlik ediblər, tənqid və böhtanlarına bəhanələr gətiriblər."[1652] Zurara bin Ayun haqqında, yəni "zorla evlənmə" hekayəsini rəvayət edən şəxs haqqında danışdıqdan sonra isə deyir: "Zurara bin Ayuna gəldikdə isə, əgər o, Ömərin Ümmü Külsümlə evlənməsi və İmam Sadiqin "bu, zorla alınmış bir namusdur" sözlərini nəql etdiyi doğrudursa, bu belə özlüyündə onu tənqid etmək üçün kifayətdir. O və onun yolu ilə gedənlər Qiyamət günü möminlərin əmiri (Əli) tərəfindən onlara qarşı qaldırılacaq bir iddia ilə üzləşəcəklər, çünki onu bu kimi münkər işlərdə ittiham ediblər; Ömərin onu

[1648] Eyni mənbə, səh: 100;
[1649] Eyni mənbə, səh: 57;
[1650] Eyni mənbə, səh: 96;
[1651] Eyni mənbə, səh: 76;
[1652] əl-Muhəmmədəvi, "Ummu Kulsum bin Əli bin Əbi Talib", səh: 201;

saymadan qızı ilə evləndiyini, yəni zor tətbiq edərək qızını ondan aldığını, bundan bir az əvvəl isə Ömərin onun evinə hücum etdiyini, orada nələr etdiyini deyiblər. Onu - ruhum ona fəda olsun! - İbn əl-Xəttab qarşısında zəif bir insan kimi təsvir etdilər və Öməri isə möminlərin namusunu pozan biri kimi göstərdilər. Əgər bu ittihamlar doğrudursa, o zaman imam zəif və qorxaq, zalımları geri dəf edə bilməyəcək qədər imansız və gücsüz biridirmi? Halbuki Allah yolunda heç bir qınayanın qınağı ona təsir etməzdi."[1653] O, həmçinin Öməri ona aid edilən ittihamlardan, o cümlədən Əli və Abbası hədələməkdən müdafiə edərək deyir: "Ömərə gəldikdə, bu rəvayətlər onu terrorçu kimi təsvir edib, çünki Allahın evinə gəlmiş zəvvarlarına su verdiyi Zəmzəm quyusunu doldurmaqla hədələyib. Zəmzəm məgər xüsusi olaraq Əli və ya Ömərəmi aid idi, yoxsa bütün müsəlmanlara? Osmanın üzləşdiyi kimi, bütün müsəlmanlarla üzləşməyə Ömərin imkanı var idimi? Bəni Haşimin fəzilətlərini məhv etməyi və saxta şahidliklə, zina və oğurluq kimi yalan ittihamlarla möminlərin əmirinə qarşı cəza tətbiq edəcəyini vəd etdi. Belə şeylər Ömər kimi bir müsəlman xəlifəsinə yaraşmaz. Üstəlik bilirik ki, o, bütün Bəni Haşimin qarşısında dayana bilməzdi, beləki onlar bütün Qureyşə qarşı dirənmişdilər, onlara Peyğəmbərə zərər vermək imkanı tanımadılar. Onda necə ola bilər ki, Ömərin şərrini dəf edə bilməsinlər? O, imama qarşı böhtan uydurmaq qabiliyyətinə malikdirmi?! Xüsusən də sonuncunun əxlaqı yaxşı məlumdur və onun həyatı təmizdir, bu ittihamlar ona bulaşa bilməzdi və insanların belə ittihamlara inanması mümkün deyildi."[1654] O, sonra bu rəvayətlərin batil olduğunu hökm etdi və dedi: "Bu rəvayətə dair hökmümüz qalır: O, yararsız və batildir, sənədi səhih olsa belə onun səhihliyinə güvənmək olmaz, çünki ağıl onu qəbul edə bilməz və çünki bunu əl-Kuleyni'dən başqası rəvayət etməyib. İstənilən halda bu, tarixi bir rəvayətdir, Quran deyil, və doğru və ya yalan ola bilər. Buna görə də, ondakı bu problemləri nəzərə alıb onu qəbul etmədən ehtiyatla yanaşılmalıdır."[1655]

Bu şiə müəlliflər əlbəttə ki, məsələni əqli analiz edərək belə bir ssenariyanın o dövrün şərtlərinə görə mümkün olmadığını dərk edirlər, çünki təhdid və məcburiyyət altında əhlul-beytdən olan bir qızı ailəsinin razılığı olmadan zorla evləndirmək Haşim oğullarının icazə verəcəkləri bir şey deyildi və iddia olunanlar tarixdən bildiklərimizlə uyğun gəlmir.

---

[1653] Eyni mənbə, səh: 203;

[1654] Eyni mənbə, səh: 204;

[1655] Eyni mənbə, səh: 204-205;

Ona görə də bu mövzuda bir şiə müəllifinin deyə biləcəyi ən insaflı sözlər hicri altıncı əsrdə yaşamış Abdulcəlil əl-Ğazvini ər-Razi'nin sözləridir. O deyir: "Şiə məzhəbi İmam Əlini - aleyhissələm - Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - üstün tutmur və ona bərabər olduğunu da iddia etmir. Bundan əlavə, Əlinin - aleyhissələm - qızı Peyğəmbərin - salləllahu aleyhi va əlihi - qızlarından üstün deyildi. Sünni məzhəbi ittifaq edir ki, Ömər Osman ibn Əffandan daha üstündür və şiələr də Peyğəmbərin - salləllahu aleyhi va əlihi - iki qızını Osmana ərə verdiyini inkar etmirlər. Əgər bu mümkün idisə - və bu həqiqətən də baş verib - o zaman bu (yəni Ummu Kulsum'un Ömərlə evlənməsi) da mümkündür. Əgər burda hər hansı bir nöqsan varsa, o zaman bu birisində də olmalı idi. Əgər bunda bir məsləhət varsa, bu birində də məsləhət vardır. Mustafa - salləllahu aleyhi va əlihi - qızlarını Allahın əmri ilə evləndirmişdi. Əli - aleyhissələm - Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - daha elmli deyildi ki, hətta buna görə bu hadisə əvvəlki hadisə ilə müqayisə edilməsin. Bu müəllif anlamalıdır ki, bu tayfaya qarşı böhtan atıb və onların adından yalan danışıb… Bu ədalətsiz və etibarsız müəllifin Əli və Abbas haqqında istifadə etdiyi sözlərin hamısı fasiqlik, küfr və zülmdür. Ömər, Abbas və başqaları bilirdilər ki, başqaları küfrlərindən sonra İslamı qəbul etdikləri halda, Əli əvvəldən mömin idi. Əgər başqaları küfr və günaha bulaşmışdısa, Əli - aleyhissələm - bütün günahlardan uzaq idi,  Peyğəmbərin - salləllahu aleyhi va əlihi - dediyi kimi: "Mən onun imandan sonra küfrə qayıdacağından və ya iffətindən sonra zinaya düşəcəyindən qorxmuram." Buna görə də Ömərin bir söz deyib deməməyindən asılı olmayaraq möminlərin əmiri (Əli) qorxmurdu. O sözlərə gəldikdə isə Ömər onları deməyib. Əgər Ömərin qohumluq bağı qurmaq arzusu ilə o sözləri dediyi fərz edilərsə, onun belə deməsi uzaq ehtimal deyildir, çünki o, məsum deyildi. Sözügedən müəllifin İmam Sadiq, aleyhissələm, əş-Şərif əl-Murtəda - Allah ondan razı olsun! - və şiələrin, imamilərin - Allah saylarını çoxaltsın! - adından dediklərinin hamısı yalan və böhtandır.[1656] Bu evlilik Əlinin - aleyhissələm - razılığı ilə baş tutub, Abbas burada vasitəçilik etməkdə doğru iş görüb və Ömərin bu

[1656] Gönürün ki, Abdulcəlil əl-Ğazvini bu sözləri o qədər ağır hesab edir ki, onları Cəfər əs-Sadiqə, əş-Şərif əl-Murtəda'ya və ümumən şiələrə nisbət etməyi yaraşdırmır. Bunun Cəfər əs-Sadiqə qarşı iftira olduğuna biz də inanırıq, lakin bu iftiranı Abdulcəlil'in rəqibi olan sünni müəllif atmayıb, bunun vəbalını şiə ravilər daşıyır. əş-Şərif əl-Murtəda'ya gəldikdə isə bu onun adına atılmış yalan deyildir, kitablarında bu sözlər mövcuddur.

evliliyə rəğbəti isə tərifə layiq idi."[1657] Abdulcəlil əl-Ğazvini haqlıdır ki, Peyğəmbər - salləllahu aleyhi va səlləm - öz qızlarını Allahın rızası ilə evləndirib və bu, Osman üçün bir fəzilət idi. Eyni şəkildə də Ömərin də əhlul-beytdən bir qızla evlənməsi onun üçün bir fəzilət idi. Ömər onsuz da bu evliliyi nə üçün istədiyini gizlətmirdi, əksinə Peyğəmbərdən - salləllahu aleyhi va səlləm - eşitdiyi bir hədisə əsasən bu evliliyin baş tutmasına səy göstərirdi. Həmçinin məşhur şiə nəsəb alimi İbn əs-Sufi yazır: "Əlinin Fatimədən olan qızı Ummu Kulsum - adı Ruqeyyə idi - Ömər bin əl-Xattab'a ərə getdi, ondan Zeyd adlı oğlu oldu. Zeyd və anası eyni gündə vəfat etdi. Bağdaddakı şərəfli, nəcib, zahid əxbari alim Əbu Muhəmməd əl-Həsən bin Əhməd bin əl-Qasim bin Muhəmməd əl-Avid əl-Ələvi əl-Muhəmmədi rəvayət edirdi ki, Ömərin evləndiyi qız cin tayfasından olub. Bizim əhlimizdən olan başqaları isə iddia edirlər ki, Ömər (onunla evlənmiş olsa da) onunla yaxınlıq etməmişdi. Digərləri isə deyirlər ki, o, İslamda qəsb edilmiş ilk övrətdir. Bu rəvayətlərdən etibar olunanı isə bizim bir az əvvəl qeyd etdiyimizdir ki, əl-Abbas bin Abdilmuttalib onu atasının razılığı və izni ilə Ömərə ərə verdi və Ömərdən Zeyd adlı oğlu oldu."[1658] Bəli, Ömər ilə Əli arasında iddia olunan ədavət sadəcə olaraq təəssübkeş beyinlərin uydurduğu bir yalandır və tarixi həqiqət budur ki, onların arasında sevgi, hörmət və qohumluq münasibətləri olub.

---

[1657] Abdulcəlil əl-Ğazvini, "Bədu Məsəlib ən-Nəvasib", səh: 278-279; ət-Tehrani, "Mərifətul-İməm", 15/262-263;

[1658] İbnus-Sufi, "əl-Məcdi fi Ənsəb ət-Talibin", səh: 199;

# İMAMƏT VƏ ƏQL

Kitabımızın sonuncu bölməsində əqli dəlillər baxımından imamət məsələsinin tutduğu yerə nəzər salacağıq. Daha dəqiq desək imamiyyə şiələrinin imamətə dair gətirdikləri ən əsas və ən fundamental arqumenti yaxından analiz edəcəyik. Bu arqument kəlam kitablarında "lütf qaydası" və ya "lütf burhanı" adı ilə tanınır. Bu qayda imamətə dair gətirilmiş əsas dəlil olduğu üçün burada əqli dəlillər içində yalnız onu analiz etməklə kifayətlənmişəm, digər arqumentlər güc və keyfiyyət baxımından lütf qaydasına ümumiyyətlə yaxın düşmür.

Onu da qeyd edək ki, imaməti əqli dəlillər ilə əsaslandırmağa çalışanlar əsasən imami şiəliyin tarixən ana xətti olmuş üsuli mədrəsəsi olub. Əxbarilər bu arqumentlərə ciddi önəm vermirlər və iki cərəyan arasındakı fərqlər barəsində daha əvvəl kifayət qədər məlumat verdik. Bu o demək deyildir ki, əxbari şiələri bu cür arqumentləri ümumiyyətlə zikr etmirlər, lakin onlar üçün imamət etiqadının isbatı əqli dəlillərə ehtiyac duymur. Üsulilərdə isə tam əksinə olaraq imamətin ümumi bir etiqadi bir prinsip olaraq ən əsas dəlili elə məhz lütf qaydasıdır. Bu barədə əl-Mufid və əş-Şərif əl-Murtəda'nın sözləri ilə kitabımızın əvvəlində tanış olduq. əş-Şərif əl-Murtəda isə yazır ki, "bizə görə "mütəvatir" imamların ümumilikdə mövcudluğunu və onların hər dövrdə mövcud olmasının vacibliyini sübut etmək yolu deyildir. Bunu isbat etməyin yolu əql və onun dəlilləridir."[1659] Şeyxut-Taifə ət-Tusi də bunu təsdiqləyir: "İmamın sifətləri bizdə əql ilə bilinir, beləliklə də nəql bura daxil deyildir."[1660] Bu ikisindən əvvəl isə əl-Mufid bununla bağlı çox kritik bir açıqlama vermişdi. O, deyir: "İmamların - aleyhimussələm - şəxsiyyətləri ilə bağlı müzakirə, onlar üçün vacib olan - səhih etibara əsaslanan - xüsusiyyətlər haqqındakı üsuldan asılıdır; beləliklə də bu üsul möhkəm şəkildə təsdiqlənməzsə, onların konkret şəxsiyyətləri

---

[1659] əş-Şərif əl-Murtəda, "əş-Şəfi fil-İmamə", 1/100;

[1660] ət-Tusi, "Təmhidul-Usul", səh: 512; (İntişarat Danişkah Tehran çapında səh: 353)

haqqında danışmaq mümkün deyildir. Bu üsuldan biri hər dövrdə bir imamın varlığının vacibliyidir, çünki bəndələr üçün ilahi **lütfün** olması, onların gözəl şəkildə idarə edilməsi və islah olunması zəruridir... Bu üsuldan bir başqası da budur ki, imam günahdan məsum, səhv və unutqanlıqdan qorunulmuş olmalıdır... Bu üsuldan bir başqası isə budur ki, imamın, ümmətin hökmlərlə bağlı ehtiyac duyduğu bütün biliklərə malik olması vacibdir... Daha bir əsl isə budur ki, imamın Allah yanında dini baxımdan bütün əhalisindən üstün olması vacibdir...Bu əsllər sabit olduqdan sonra, İmamın - onun kimliyinə dəlalət edən nass ilə və adəti pozacaq möcüzəvi elm ilə - öz rəiyyəsi içindən fərqləndirilməsi/seçilməsi vacib olur. Çünki bu xüsusiyyətləri özündə cəm etmiş şəxsi tanımağın yeganə yolu ya Allahın peyğəmbərindən olan açıq bəyan və ya möcüzə ilə mümkündür... Beləliklə də imamların - aleyhimussələm - kimliklərinə dəlalət edən açıq bəyanın (nassın) olması vacibdirsə və bunu Peyğəmbərdən - salləllahu aleyhi va əlihi - sonra möminlərin əmirindən, əl-Həsən, əl-Hüseyn və onların soyundan olan imamlardan başqa heç kəsdə—nə iddia, nə də bəyan yolu ilə - tapa bilmiriksə, o zaman onların həmin imamlar olmaqları yuxarıdakı üsulun doğruluğuna əsasən əqlin şahidliyi və bunu vacib etməsi ilə təsdiqini tapır."[1661] Bu sözlərdəki iki yerə diqqət yetirmək lazımdır. əl-Mufid bizə başa salmağa çalışır ki, imamət etiqadının hər şeydən əvvəl əqli dəlilləri var və bu əqli dəlillər imamət etiqadının üsulunu, bünövrəsini təşkil edir. Bu əqli dəlilləri qəbul etdikdən sonra baxmaq lazımdır ki, kimlər bu əqli üsulu uyğun gəlirlər və bu uyğunluq ya "iddia ilə, ya da bəyan yolu" ilə sabit olur. Bu o deməkdir ki, əlimizdə hansısa imamın Allahın təyin etdiyi imam olduğuna dair mütəvatir nass olmasa belə yenə də belə bir imamın mövcud olmasının zərurətindən çıxış edərək imam olduğu iddia olunan şəxsin imam olması lazımdır. Çünki əl-Mufidə görə əqli dəlillərin tələbi budur ki, heç bir zaman məsumiyyət və ləduni elmə sahib bir imamdan xali ola bilməz. Peyğəmbər – aleyhissalətu vassələm – vəfat etdikdən sonra belə bir imamın olması şərt idi. Hətta əlimizdə Əlinin təyin olunmasına dair bəyan olmasa belə yenə də Əlinin imam olması lazımdır, çünki ondan başqa birinin məsum və hamıdan elmli bir imam olduğu iddia olunmayıb; yalnız onun üçün belə bir vəsf iddia olunub. Başqa bir namizəd qalmadığı üçün Əlinin imam olması lazımdır.

[1661] əl-Mufid, "əl-Məsəil əl-Cərudiyyə", səh: 44-46;

Bu xətti izləyən arqumentlər ilə biz şiə kəlam kitablarında tez-tez qarşılaşırıq. əl-Mufid'dən əl-Hilli'yə, ondan da əs-Subhani kimi günümüzün şiə alimlərinə qədər xeyli sayda mütəkəllimin kitablarında bu dəlilləndirmə metodunu müxtəlif şəkillərdə oxumaq mümkündür. Ona görə də üsuli şiələrində əqli dəlilin əhəmiyyəti çox böyükdür. Bunun üçün bizim bu əqli dəlil ilə tanış olmağımız və onun nə dərəcədə etibarlı bir dəlil olduğuna baxmağımız lazımdır.

## Lütf Qaydası

Lütf qaydası və ya lütf burhanı olaraq tanınan dəlil imami şiələrinin imamət etiqadı üçün gətirdikləri əqli dəlillərin başında gəlir. əş-Şərif əl-Murtəda'nln və şeyxi əl-Mufid'in yuxarıda sözünü eydiyi "əql və əqlin dəlilləri" deyərkən hər şeydən əvvəl nəzərdə tutulan "lütf dəlilidir". Qeyd etməliyik ki, bu arqumenti şiələr ümumi imamət üçün dəlil gətirirlər, yəni imam məqamının ümumən mövcud olmasını göstərmək üçün istifadə edirlər. Bu qayda ilə bağlı verilmiş ən məşhur tərifə görə lütf "mükəlləfi itaətə yaxınlaşdıranın və onu üsyandan uzaqlaşdıranın adıdır; sonra əgər lütf, mükəlləfiyyətin baş verməsi ilə bağlı olarsa buna "təhsil edici lütf" deyilir, əks təqdirdə "təqrib edici lütf" adlanır."[1662] Təqrib edici burada "yaxınlaşdırıcı" anlamındadır; bu növ lütf mükəlləf bəndəni itaətə yaxınlaşdırır, günahlardan uzaqlaşdırır. əş-Şərif əl-Murtəda yazır ki, "lütf, itaət etməyə çağırana deyilir; iki yerə bölünür: 1) olduğu təqdirdə mükəlləfin itaət etməyi seçəcəyi, əks təqdirdə seçməyəcəyi (növ) və 2) (olduğu təqdirdə) seçməyə ən yaxın olan (növ). Hər iki qisim, lütfü, çağıran səbəb olaraq öz içinə alır."[1663] Bununla o, lütfün məcburiyyət olmadığını izah etməyə çalışır; yəni Allahın lütfü, bəndəni itaət etmək və günahı rədd etmək seçiminə yaxınlaşdırıcı bir səbəbdir, lakin bununla belə bəndə mükəlləfiyyətini itirmir, seçim haqqını saxlayır. Başqa şəkildə deməli olsaq deyə bilərik ki, lütf elə bir feldir ki, Allah onunla mükəlləfə itaəti seçmək, günahı rədd etmək imkanı verir, bu imkanı onun üçün yaxınlaşdırır.

---

[1662] əs-Subhəni, "Muhədarat fil-İləhiyyət", səh: 187;

[1663] əl-Murtəda, "əz-Zəxira fi İlm əl-Kələm", səh: 186;

Yaxınlaşdırıcı (muqarrib) lütfün əsas ideyası budur ki, Allah bu lütfü etməsə belə, insanın itaət etməsi və günahdan çəkinməsi mümkündür. Ancaq Allah bu lütfü həyata keçirdikdə, insan itaətə daha çox meyl edir və günahdan daha çox uzaqlaşır. İkinci növ lütf isə, yəni muhassil lütf, Allahın elə bir iş görməsidir ki, həmin iş həyata keçdikdə insan itaəti mütləq yerinə yetirir və əksi mümkün olmur. Əgər bu lütf olmasa, insan itaəti yerinə yetirə bilməz. Əgər bu lütf itaətin hasil olması ilə bağlıdırsa buna "tövfiq" deyilir, əgər günahlardan çəkinməklə bağlıdırsa buna "ismət" (məsumluq) deyilir. Bunu bəzən "əgər fılan şey olmasaydı məqsəd hasil olmazdı" şəklindəki cümlələrlə ifadə edirlər. əl-Alləmə əl-Hilli deyir ki, "Bəzən lütf muhassil olur və bu, onun olduğu zaman mükəlləf tərəfindən öz seçimi ilə itaətin hasil olmasıdır. Əgər bu lütf olmasaydı, o, itaət etməzdi, baxmayaraq ki, hər iki halda (lütf olsun və ya olmasın) itaət etmək imkanına malikdir."[1664] Məsələn, əgər desək ki, Allahın məqsədi insanların Ona itaət etməsi və ibadət etməsidir və desək ki, peyğəmbərlərin göndərilməsi bu məqsədi gerçəkləşdirir və əgər peyğəmbərlər göndərilməsəydi, bu baş verməzdi, bu, **muhassil lütfdür**. Lakin əgər desək ki, insanlar peyğəmbər göndərilmədən də itaət edə bilərlər, amma peyğəmbərin göndərilməsi onları bu itaətə daha çox yaxınlaşdırır, onda bu, **yaxınlaşdırıcı (muqarrib) lütfdür**.

Burada mütəkəllimin (kəlami alim) lütfün muhəssil formasında iki əsas elementi nəzərə aldığı görünür: Birincisi, itaətin gerçəkləşdiyi halı nəzərə almaq. İkincisi, itaətin lütflə əlaqəsini nəzərə almaq; yəni, əgər lütf olmasaydı, itaət də baş verməzdi. Onların sözlərindən görünən odur ki, muhəssil lütfü formalaşdıran əsas amil, mükəlləfin lütfdən sonra itaəti yerinə yetirib-yetirməməsi ilə müəyyən edilir. Bu, lütfün muhəssil və yaxınlaşdırıcı olmasının nisbi bir bölgü olduğunu göstərir və bu bölgü mütləq mənada lütfü icra edən Allaha deyil, insana bağlıdır. Yəni, Allahın müəyyən bir işi həyata keçirməsi, Zeydi itaətə daha da yaxınlaşdırırsa və onun bu itaəti yerinə yetirməyə olan meyli artırsa, lakin Zeyd yenə də itaət etmirsə, bu, yaxınlaşdırıcı lütf sayılır. Ancaq həmin ilahi hərəkətin eynisi Ömər üçün itaəti mütləq yerinə yetirməyə səbəb olarsa, o zaman həmin ilahi hərəkət muhəssil lütf adlanır. Bu isə bölgünün ilahi hərəkətin öz mahiyyəti və ya Allahın zatı ilə deyil, insanların öz vəziyyətləri ilə əlaqəli olduğunu göstərir. Başqa sözlə, bölgü lütfün növündə deyil, onun nəticəsində baş verən hadisələrdədir. Mütəkəllimlər arasında geniş yayılmış və həm mötəzililər, həm də

[1664] əl-Hilli, "Kəşful-Murad fi Şərh Təcrid əl-İtiqad", səh: 444;

imamiyyə alimləri tərəfindən qeyd edilən nümunə belədir: Əgər bir şəxs qonağı evinə dəvət etsə və məqsədi onun evə gəlib onunla birlikdə nahar etməsi olsa, lakin qonağın bu dəvəti qəbul etməyəcəyini bilsə, onda ev sahibi öz oğlunu göndərərək onu dəvət etməli və onu müşayiət etməlidir ki, qonaq evə gəlsin. Bu halda, əgər ev sahibi oğlunu göndərməzsə, o, öz məqsədinə zidd davranmış olar. Əgər oğlu göndərilməsəydi, qonaq gəlməyəcəkdi. Əgər qonaq gəlibsə, demək ki, oğlunun göndərilməsinin bunda rolu olmuşdur. Bu halda, qonağın gəlişi artıq baş verdiyindən, bu **muhəssil lütfdür**. Digər tərəfdən, əgər qonaq ev sahibinin oğlunu göndərməsə belə, gəlmək imkanına malikdirsə, lakin oğlunun göndərilməsi onun qərarını gücləndirib onu qonaqlığa daha da yaxınlaşdırırsa və bununla belə, o, gəlmirsə, onda bu **yaxınlaşdırıcı (müqərrib) lütf** sayılır.

Lakin bunun qarşısında diqqətlə düşünmək bizi mütəkəllimlərin sözlərini fərqli şəkildə təhlil etməyə yönləndirə bilər. Bu da muhəssil və yaxınlaşdırıcı (müqərrib) lütfün bölgüsünü insanın lütfə nə dərəcədə cavab verməsi ilə əlaqələndirmək əvəzinə, ilahi əməlin insanla olan münasibətinə əsaslanan həqiqi bir bölgü kimi dəyərləndirməkdən ibarətdir. Bu zaman belə deyə bilərik: Yaxınlaşdırıcı (müqərrib) lütf – insanın onu əldə etmədən də itaəti yerinə yetirə bilməsinə baxmayaraq, bu lütf onun itaətə yönəlməsində və itaəti yerinə yetirmə imkanının artmasında rol oynayır. Muhəssil lütf – insanın itaəti yerinə yetirə bilməsi üçün mütləq ehtiyac duyduğu lütfdür. Onsuz itaət baş verməz, lakin bu lütf itaəti məcburi şəkildə gerçəkləşdirmir. İnsan itaəti yerinə yetirməyə də, onu tərk etməyə də qadir qalır ki, bu da məcburiyyətin (ilcə) qarşısını alır. Bu bölgü o deməkdir ki, muhəssil və yaxınlaşdırıcı lütf arasındakı əsas fərq insanın itaəti həmin lütf olmadan da yerinə yetirib-yetirə bilməməsidir. Muhəssil lütf ilə itaət mütləq olaraq lütfə bağlıdır, bunsuz baş verməz, yaxınlaşdırıcı lütfdə isə itaətin baş verməsi lütfə mütləq bağlı deyil, lütf sadəcə bunu gücləndirir. Buna görə də muhəssil lütf itaətin baş verməsində həlledici bir vasitə kimi qəbul edilir, yaxınlaşdırıcı lütf isə sadəcə əlavə bir stimuldur. Beləliklə deyə bilərik ki, muhəssil lütf yaxınlaşdırıcı lütfə nisbətən daha güclü bir lütf növüdür və itaətin gerçəkləşməsi üçün daha vacibdir. Bu da bəzi kəlami alimlərin yaxınlaşdırıcı lütfü deyil, yalnız muhəssil lütfü vacib görməsinə yol açır.

Burada anlamaq lazımdır ki, lütf qaydasını dəlil gətirən firqələr öz aralarında bu qaydanın əsaslandığı prinsipin nə olduğunda ixtilaf

ediblər. Onlardan kimisi deyib ki, bu qayda Allahın Hikmətinə əsaslanır. Bəziləri isə bunu Allahın kəraməti və rəhməti ilə əlaqələndirirlər. Bir başqa qrup isə lütfün ilahi ədalət prinsipinə söykəndiyini deyir. Fayda üçün və lütf qaydasını daha yaxından anlamaq üçün bu izahlara yaxından baxmağımız məsləhətdir.

Birinci dəlil – müxtəlif ifadələrdən ibarət olsa da, hamısı eyni məzmunu ifadə edən – hikmət dəlilidir. Xacə Nəsirəddin ət-Tusi "ət-Təcrid" əsərində bunu qısa şəkildə belə ifadə etmişdir: "Lütf vacibdir, çünki onun vasitəsilə məqsəd hasil olur." Allamə əl-Hilli bunun izahında yazır: “Bunun vacibliyinin dəlili budur ki, mükəlləf qılanın (yəni Allahın) məqsədini hasil edir, buna görə də vacib olur, əks təqdirdə məqsədin pozulması gərəkir. Aradakı əlaqənin izahı budur ki, təklif qoyan (yəni Allah) bilsə ki, mükəlləf yalnız lütf vasitəsilə itaət edəcək və buna baxmayaraq onu heç bir lütf olmadan mükəlləf edərsə, bu, Öz məqsədini pozmaq olacaq. Necəki bir kimsə digərini yeməyə dəvət edərsə, lakin eyni zamanda həmin adamın yalnız müəyyən bir nəzakət formasına riayət edildikdə dəvətə cavab verəcəyini bilərsə, əgər dəvət edən şəxs bu nəzakət formasına əməl etməzsə, bununla öz məqsədini pozmuş olur. Buna görə də lütfün vacib olması məqsədin hasil olmasını labüd edir.”[1665] əl-Qadi Abdulcəbbar əl-Mutəzili deyir: “Bizim seçdiyimiz məzhəbin düzgünlüyünə dəlalət edən dəlil budur ki, Allah-Təala mükəlləfi itaətlə mükəlləf edərək onu savab qazanmağa yönəltməyi qarşısına məqsəd qoymuşdur. Əgər Allah bilsə ki, mükəlləfin itaət etməsi üçün müəyyən bir şeyin baş verməsi lazımdır və bu Onun qüdrətindədir, o halda hökmən həmin şeyi etməlidir. Əks halda, məqsədini pozmuş olar. Və onun vəziyyəti eynilə bir insanın dostunu yeməyə dəvət etməsinə bənzəyər. Əgər bilsə ki, dostu yalnız ona ən yaxın birinin – məsələn, övladının və ya başqa sevimli birinin dəvəti ilə gələr, o zaman həmin adamı göndərmək onun üçün vacib olur. Əgər bunu etməzsə, məqsədini pozmuş olar. Burada da məsələ eynilə belədir.”[1666] Şeyx əl-Müfid də bu dəlili fərqli şəkildə ifadə edərək eyni məzmunu açıqlamışdır: "Əgər soruşulsa ki, peyğəmbərlərin və rəsulların göndərilməsinin hikmət baxımından vacib olduğuna dəlil nədir?" Cavab: Dəlil budur ki, bu, lütfdür və lütf hikmətdə vacibdir. Buna görə də peyğəmbərlərin və rəsulların göndərilməsi hikmət baxımından vacibdir. Əgər soruşulsa ki, lütf nədir? Cavab: Lütf – insanı

---

[1665] əl-Hilli, “Kəşful-Murad”, səh: 109-110, (əs-Subhəni təhqiqi); səh: 444-445 (əl-Əmili təhqiqi)

[1666] Abdulcabbar, “Şərh əl-Usul əl-Xamsə”, səh: 353;

itaətə yaxınlaşdıran və günahdan uzaqlaşdıran, lakin onu qadir etməkdə heç bir rolu olmayan və məcburiyyət həddinə çatmayan bir şeydir. Əgər soruşulsa ki, lütfün hikmət baxımından vacib olduğuna dəlil nədir? Cavab: Onun vacibliyinə dəlil, mükəllifin (yəni Allahın) məqsədinin (reallaşmasının) ondan asılı olmasıdır. Belə olduqda, lütf hikmət baxımından vacib olur və bu da bizim istədiyimiz nəticədir."[1667] Beləliklə də bu arqument quruluş baxımından aşağıdakı prinsiplərə əsaslanır: Birinci: Lütf məqsədin hasil olmasına səbəb olur. İkinci: Hər bir şey ki, məqsədin hasil olmasına səbəb olur, o vacibdir. Çünki əks halda məqsədin pozulması lazım gələr ki, bu da hikmət sahibi üçün qeyri-mümkündür. Nəticə: Hər bir lütf vacibdir. Burada gördüyümüz kimi əl-Mufid lütf arqumentinin dayandığı əsasın ilahi hikmət olduğunu təsdiqləyir və bu, onun “ən-Nukət” kitabında verdiyi izahdır. Onun başqa kitablarında fərqli izahları olduğunu görə bilirik.

Bir çox mütəkkəllimin qeyd etdiyi bir başqa lütf arqumenti isə Allahın qüdrəti və iradəsi ilə bağlıdır. Onun məğzi budur ki, Allah-taala bəndələri itaətə yaxınlaşdırmağa yönəlmiş iradəyə, istəyə və buna çağıran amilə malikdir, bu isə aydındır. Həmçinin Onun bunu həyata keçirmək üçün qüdrəti də vardır – yəni, onları saleh əməllərə yaxınlaşdırmaq və fəsadlardan uzaqlaşdırmaq imkanı vardır. Beləliklə, əgər həm iradə, həm də qüdrət bir araya gələrsə, lütfün baş verməsi zəruridir; əks halda, bu, qəbahət olar. Allamə əl-Hilli bu barədə belə deyir: “Üçüncü: (Allahın) lütfə qadir olması sabitdir və ona dair iradə mövcuddur. Çünki bir işə dəvət edən onun həyata keçməsi üçün zəruri olan şeylərə də dəvət edir. İradə və qüdrət bir yerə toplandıqda isə, felin baş verməsi vacib olur."[1668] Bununla onu demək istəyir ki, Allah qullarının itaət etməsini istəyir və buna çağırır, həmçinin demək istəyir ki, qulların bunu yerinə yetirməsi yalnız və yalnız lütfün olması ilə mümkündür. Bu isə o deməkdir ki, Allah həm də lütfün olmasını da istəyir, onun da olmasına ehtiyac vardır və Allah o lütfü ortaya çıxarmağa qadirdir. Bu iki müqəddiməyə əsasən əl-Hilli deyir ki, Allahın bunu istədiyi və buna qadir olduğu halda bunu etməməsi qəbahət olardı.

Daha bir arqument əvvəlki arqumentlərdən fərqli bir mexanizmə əsaslansa da, ruh və düşüncə baxımından demək olar ki, eynidir. Onu aşağıdakı şəkildə formalaşdırmaq olar: Birinci: Hər bir lütf – ilahi

---

[1667] əl-Mufid, “ən-Nukət əl-İtiqadiyyə”, səh: 35;

[1668] əl-Hilli, “Ənvarul-Mələkut fi Şərh əl-Yaqut”, səh: 155;

rəhmət, kərəm və cömərdliyin ifadəsidir və ya onlarla ayrılmaz şəkildə bağlıdır. İkinci: Bütün ilahi sifətlər öz reallıqlarına uyğun şəkildə gerçəkləşməlidir; əks halda, onların pozulması baş verər. Üçüncü: İlahi sifətlərin pozulması isə qeyri-mümkündür. Nəticə: Lütfün gerçəkləşməsi vacibdir. Bu arqumenti əks tərəfdən də ifadə etmək mümkündür: Birinci: Lütfdən imtina etmək (lütfü tərk etmək) rəhmət, kərəm və cömərdliklə ziddiyyət təşkil edir. İkinci: Allahın zatı ilə ziddiyyət təşkil edən heç bir şey Ona aid edilə bilməz. Üçüncü: Deməli, lütfdən imtina etmək Allah üçün qeyri-mümkündür. Nəticə: Lütfün baş verməsi zəruridir. Bu izah əl-Mufid'in "Əvailul-Məqalət" kitabında verdiyi izahdır; beləki buyurur: "Lütf əshabının vacib gördükləri lütf yalnızca comərdlik və kərəm baxımından vacib olur, yoxsa (ilahi) ədalətin bunu vacib qılmasını və Allahın bunu etmədiyi təqdirdə zalım olacağını zənn etmələri doğru deyildir."[1669] Gördüyümüz kimi "ən-Nukət" kitabında lütfü Allahın hikmətinin gərəyi olaraq gördüyü halda burada onu Allahın Cavad (comərd) və Kərim (əliaçıq, səxavətli) sifətləri ilə əlaqələndirir. Şeyx əlMüfid burada ədl məktəbinin (mötəzilə və imamiyyə) bəzi meyillərini açıq şəkildə tənqid edir. Belə görünür ki, o, bu məktəbin Allah ilə bəndələri arasında qarşılıqlı hüquqların olduğunu qəbul etdiyini, yəni Allahın qulları üzərində haqları olduğu kimi, qulların da Allah üzərində haqlarının olduğunu və ədalətin hər haqq sahibinə haqqını vermək olduğunu irəli sürdüyünü göstərir. Bu isə öncədən bəndələrin Allah üzərində müəyyən hüquqlara malik olduğunu ehtiva edir. Belə ki, əgər Allahın ədalət sahibi olduğunu isbat etsək, deməli, bu hüquqlar da təsdiqlənmiş olur. Bu hüquqlardan biri də lütfdür. Odur ki, lütf prinsipini ədalət prinsipinə əsaslandıran hər kəs bəndələrin Allah üzərində müəyyən hüquqlara malik olduğunu qəbul etməlidir. Belə ki, əgər Allah bu hüquqları yerinə yetirsə, ədalətli sayılar, əks halda zalım olar.

Beləliklə aydın olur ki, lütfün əsasının ilahi ədalət olduğunu deyənlər də mövcuddur. Bu, əl-Mufid'in zamanında olduğu kimi bizim zamanımızda da özünə tərəfdaşlar qazanmış bir izahdır. Muhəmməd Baqir əs-Sadr yazır ki, lütf "kəlam elmindəki ədalət prinsipindən qaynaqlanan bir qaydadır, çünki bununla Allahın adil olması hökmündən hərəkət edərək əqlin Allah üçün nəyin vacib olduğunu dərk etməsi qəsd olunur."[1670] Bu fikrin kökündə duran məntiq budur

---

[1669] əl-Mufid, "Əvailul-Məqalət", səh: 59;

[1670] Muhəmməd Baqir əs-Sadr, "Buhus fi İlm əl-Usul", 4/305;

ki, Allahın bəşəriyyəti yaradandan sonra onları doğru yola yönəltmədən, onlar üçün o doğru yolu asanlaşdırmadan tərk etməsi Onun ədalətinə yaraşmadığı üçün imamların mövcud olması zəruridir. Belə bir zərurilik Allahın ədalətindən qaynaqlanır, əks təqdirdə - iddiaya görə - Allahın adil olduğunu demək olmaz. Bu iddia əslində mötəzililər və imami şiələrdə mövcud olan "ədalət" anlayışından qaynaqlanır, ona görə də bu məsələni daha yaxşı anlamaq üçün "ədalət" anlayışında ümmətin cumhuru ilə mötəzililər arasındakı fərqləri öyrənmək lazımdır. Bəzi şiə alimləri isə bu izahların bir neçəsini eyni zamanda doğru saya bilirlər. Muhəqqiq ən-Nəraqi lütf prinsipinin əsas təməllərini müxtəlif cəhətlərdən izah edərkən burada açıq şəkildə fərqli yanaşmalar irəli sürür. O belə deyir: "Onların lütfdən məqsədi ya hər haqq sahibinə öz haqqını vermək, yəni onun layiq olduğu şeyi təqdim etmək, ya məsləhət və məfsədətləri bəyan etmək, ya mütləq şəkildə ehsan, ikram və nemət bəxş etmək, ya da bəndəni Allaha yaxınlaşdıran və Ondan uzaqlaşdıran şeyləri izah etmək, yaxud da bu mənalara yaxın olan başqa bir şeydir. Lütf bu mənalardan bəziləri baxımından qəti şəkildə Allah üçün vacibdir və bunda heç bir şübhə yoxdur, məsələn, ilk iki məna kimi. Bəzi digər mənalar isə şübhəsiz ki, müəyyən dərəcədə vacibdir, baxmayaraq ki, hər bir növü və hər bir mənası ilə Allah üçün tam şəkildə vacib deyil, məsələn, üçüncü məna kimi. Digər bəzi mənalar isə Allah üçün vacib olub-olmaması baxımından müzakirə edilə bilər, məsələn, sonuncu məna kimi."[1671]

Burada lütf haqqında təqdim etdiyimiz məlumatlar ümumilikdə "lütf" prinsipinin hansı məzmunda söyləndiyini və hansı çərçivədə müzakirə olunduğunu izah etmək üçün idi. Burada lütf prinsipindən ortaya çıxan bir başqa nəticəyə diqqət çəkməyimiz lazımdır. Nəsiruddin ət-Tusi "ət-Təcrid" kitabında yazır: "Əgər (lütf) Allahın Öz felindəndirsə Ona vacib olur, əgər mükəlləfdəndirsə o zaman ona bunu öyrətmək və ona vacib etmək (Allaha) vacibdir…" əl-Hilli bu sözlərin şərhində deyir: "… İkinci; (lütfün) mükəlləfin öz felindən olmasıdır, o zaman (mükəlləfə) bunu öyrətmək, bildirmək və ona bunu vacib etmək Allaha vacibdir…"[1672] Buradan çıxan nəticə budur ki, əgər imamların olması bir lütfdürsə o zaman imamların olduğunu mükəlləf bəndələrə öyrətmək, onlarda şübhəyə yer buraxmayacaq şəkildə bu barədə məlumat vermək Allaha vacib olmalıdır. Əgər həqiqətən də Allah insanlığın hidayəti üçün peyğəmbərlərdən sonra imamlar təyin edibsə,

---

[1671] ən-Nəraqi, "Avaidul-Əyyəm", səh: 705;

[1672] əl-Hilli, "Kəşful-Murad fi Şərh Təcrid əl-İtiqad", səh: 303-304;

o zaman insanların bu imamların varlığı haqqında bilmələri üçün Allahın açıq-aşkar hüccətinin olması lazımdır. Biz də bu kitabımızda şiələr tərəfindən "hüccət" olaraq iddia olunan arqumentlərin həqiqətən də "hüccət" olub olmadığına baxdıq və şiə alimlərinin öz etirafları ilə ən əsas arqumentlərin "gizli" dəlillər olduğunu gördük, yəni bu dəlillər dəlalət baxımından aşkar deyil, onların anlaşılması üçün müqəddimələrə ehtiyac var. Bu isə özlüyündə "lütf qaydasının" problemli olduğunu göstərir.

əl-Hilli deyir: "Allah – təalə - Öz ixtiyarı ilə faildir, qüdrət və səbəb mövcud olduqda felin olması vacib olur. Mütləq yaxşılıq itaətləri yerinə yetirməklə və günahlardan çəkinməklə əldə edilir. Məsum (İmam), bu məsələdə bir lütfdür, onun hasil olmasını təmin edir və onsuz (mütləq yaxşılıq) hasil olmaz. Allah yaxşılığın olmasını istəyir və onu sevir, çünki O buyurur: "Allah yaxşılıq edənləri sevir." [3:134] Bu da Onun buna olan iradəsinin təkidli olduğuna dəlalət edir. O, bunu mükəlləf insanın azad seçimi ilə istəyir. Buna görə də, Onun, mütləq yaxşılığa nail olmağın ondan asılı olduğu, qulunu ona yaxınlaşdıran və ziddindən uzaqlaşdıran, lakin məcbur etmək həddinə çatmayan lütfləri istəməsi vacibdir. Nəticədə, O, məsumu yaratmağı və ona itaət etməyi əmr etməyi istəyir, çünki qüdrət və səbəb mövcuddur və maneə yoxdur, əks təqdirdə bu, ilahi iradəyə zidd olardı. Maneənin olmaması təsdiqlənmişdir və sübut olunması istənilən də budur."[1673] Beləliklə də əl-Hilli demək istəyir ki, Allah yaxşılığın hasil olmasını istəyir, lakin bunu insanlara məcbur etmək Onun hikmətindən deyildir. O zaman mükəlləfiyyət pozulmadan bu yaxşılığın hasil olması üçün gərəkli olan ən yaxın yol nədirsə onun baş verməsi vacib olmalıdır. əl-Hilli'yə görə bu mütləq yaxşılığı, bu hidayət səbəblərini mükəlləf qullara yaxınlaşdırmağın yeganə yolu məsum imamların olmasıdır. Burada əl-Hilli'nin izahında təhlükəli olan bir məsələ vardır. O deyir ki, Allah Öz ixtiyarı ilə faildir, lakin əlavə edir ki, "qüdrət və səbəb mövcud olduqda felin olması vacib olur." Bu sözdə aşkar bir ziddiyyət var, çünki ixtiyar sahibi biri üçün qüdrətin və səbəbin olması felin olmasını vacib etməz; əksinə qüdrət və səbəb olsa belə bunu etməməyi seçməsi də mümkündür, çünki Allah ixtiyar sahibidir. əl-Hilli başqa yerdə buyurur: "Allah qullarına qarşı şəfqətli olduğunu hökm etmişdir. Buna əsasən mükəlləfiyyət felinin asılı oluğu lütfləri etmək vacib olur. Lütflərin hamısı və nemətlərin hamısı məsumun təyin edilməsi lütfünə müqayisədə kiçik və əhəmiyyətsizdir və ən böyük nemət və ən mühüm

[1673] əl-Hilli, "əl-Əlfeyn fi İməməti Əmir əl-Muminin", səh: 120

lütf hər dövrdə məsumun olmasıdır. Ona görə də, Özünü şəfqətli və mərhəmətli kimi vəsf edən birinin məsumu təyin etməsi vacibdir."[1674] Bu kimi ifadələr ona dəlalət edir ki, əl-Hilli'nin məzhəbinə görə insan əqli nəyin Allah üçün vacib olduğunu müəyyən edə biləcək avtoritetə sahibdir. Sanki Allahdan ötədə və fövqündə müəyyən əqli prinsiplər vardır ki, Allahın onlara tabe olması vacibdir.

İstənilən halda əl-Hilli'nin dediyi kimi "lütflərin hamısı və nemətlərin hamısı məsumun təyin edilməsi lütfünə müqayisədə kiçik və əhəmiyyətsizdirsə" biz bu lütfün dəlillərini açıq şəkildə görməliyik. Əks təqdirdə lütf məzhəbinə görə Allah Öz hikmətində qüsurlu davranmış olacaq. Haşa!

## Lütf Dəlilinin Tutarsızlığı

Lütf qaydasını izah edərkən qeyd edilir ki, bu qayda iki nəzəri müqəddimə üzərində bina edilib. İlk müqəddimə budur ki, peyğəmbərlərin, imamların bəşəriyyətə göndərilməsi bir lütfdür. İkinci müqəddimə isə budur ki, bu şəkildə qullarına lütf göstərmək Allaha vacibdir. Beləliklə də bu iki müqəddimədən ortaya çıxan nəticəyə əsasən imam məqamını yaratmaq və imam təyin etmək Allaha vacib olur. Bu müqəddimələr özləri də kəlam elmində "təhsin və təqbih" məsələsi ilə bağlıdır. Təhsin və təqbih məsələsi isə fellərin özlüyündə gözəl və çirkin olması, insan əqlinin bunu dərk etməyə qadir olması sualı ətrafında dönür. Biz bir şeyin gözəl və ya çirkin, xeyir və ya şər olduğunu deyərkən həmin şeyin özlüyündə gözəl və çirkin olduğunu yoxsa Allah onu halal və ya haram etdiyi üçün gözəl və çirkin olduğunu qəsd edirik? Lütf qaydasının ikinci müqəddiməsi, yəni lütfün Allaha vacib olduğunu iddia etmək kəlam elmindəki təhsin və təqbih məsələsində gəlinən nəticədən asılıdır. Ona görə də şiə alimi Sədiduddin Mahmud əl-Himsi ər-Razi yazır: "Bil ki, biz bu mövzuda yalnız ədalət məktəbinə (əl-ʿadl) mənsub olan, lütfün zəruriliyini qəbul edib bu baxışda bizimlə həmfikir olan mötəzililər ilə danışırıq; əqli təhsin və təqbihi (yaxşının və pisin ağılla dərkini) inkar edən, lütfün

[1674] Eyni mənbə, səh: 156-167;

vacibliyini rədd edən digər firqələrlə isə sözümüz yoxdur. Çünki bu əsas lütfün vacibliyi üzərində qurulub və o, bunun qoludur; təməlini inkar edən kəslə həmin təməldən asılı olan füru barədə müzakirə etmək münasib olmaz. O kəslə hər şeydən əvvəl təməl üzərində razılaşmağımız lazımdır, sonra onun üzərində fürunu qurmaq olar. Buna görə də, istisna etdiyimiz qruplardan başqa hər hansı firqə ilə mübahisəyə girdikdə, əvvəlcə qeyd etdiyimiz lütfün vacibliyi prinsipi üzərində onlarla razılaşmalıyıq; əgər bunu doğrudan da etiqadən qəbul etsələr və ya mübahisə xatirinə bizə güzəşt etsələr, məqsədimizi onun üzərində qururuq; əks halda təməlini inkar etdikləri bu furu barədə onlarla danışmırıq."[1675] Əgər əvvəl zikr etdiyimiz o iki müqəddiməyə qayıtmalı olsaq Şiə alimi Kəməl əl-Heydəri'nin bölgüsü ilə gedərək deməliyik ki, bu ikinci müqəddimə özü üç əsasın isbat edilməsindən asılıdır:

Birinci əsas: Fellər özlüyündə gözəl və çirkindir, yoxsa Allah onları halal, vacib və ya müstəhəb etdiyi üçün gözəl, haram etdiyi üçün isə çirkindir? Misal üçün yalan danışmaq özlüyündə çirkin əməldir yoxsa Allah yalan danışmağı haram etdiyi üçün çirkin əməldir. Beləliklə də lütf qaydasının ikinci müqəddiməsini isbat etmək üçün hər şeydən əvvəl fellərin özlüyündə gözəl və çirkin olduqlarını isbat etmək lazımdır.

İkinci əsas: Hətta fellərin özlüyündə gözəl və çirkin olduğu isbat edilmiş olsa belə, burada ikinci sual ortaya çıxır. İnsan əqli bu fellərin gözəl və çirkin olduğunu izhar etməyə, yəni hansı felin gözəl, hansının çirkin olduğunu kəşf etməyə qadirdirmi? Çünki əgər insan əqli təşxis qoymaqda acizdirsə bu müqəddimə süquta uğrayır.

Üçüncü əsas: Hətta fellərin özlüyündə çirkin və gözəl olduğunu, hətta insan əqlinin fellərin çirkin və gözəl olduğunu kəşf etməyə qadir olduğunu desək burada üçüncü sual qalır; insan əqli insanların fellərinin çirkinliyi və gözəlliyi üzərində hakim ola bilsə də, Allahın fellərinə gəldikdə eyni sözü deyə bilərikmi? Çünki Allahı bəşəriyyətə müqayisə etmək olmazsa təbii ki, Onun fellərini məxluqatın felləri ilə müqayisə etmək doğru olmaz.

Bu o deməkdir ki, lütf qaydası mübahisəli əsaslar üzərində qurulub. Hər şeydən əvvəl İslam alimləri birinci əsas üzərində fikir ayrılığındadırlar. Əşarilər və hənbəlilərin əksəriyyəti fellərin özlüyündə çirkin və gözəl olduğunu qəbul etmirlər, onlara görə bir şey Allahın

[1675] əl-Himsi, "əl-Munqiz min ət-Təqlid", 2/239-240;

qadağan etməsi ilə çirkin, əmr etməsi ilə gözəl olur. Hətta birinci əsasda digər rəyin, yəni maturidilər, mötəzililər və şiələrin rəyini qəbul etsək və fellərin özlüyündə gözəl və çirkin olduğunu desək, ikinci əsasda daha da güclü fikir ayrılığı ilə qarşılaşırıq. Çünki burada şiə alimləri özləri də öz aralarında ixtilaf ediblər; insan əqli fellərin gözəlliyini və çirkinliyini kəşf etmək üçün kifayət qədər qüdrətə sahibdirmi? Əxbari şiələr bu nöqtədə üsulilərdən fərqlənirlər; beləki onlara görə şəriətin hökmlərini müəyyən etməkdə yeganə meyar Quran və imamlardan gələn xəbərlərdir və bunların içində ən əsas meyar isə imamların xəbərləridir, əql nəyin gözəl və çirkin olduğunu kəşf etməkdə acizdir.[1676] Əxbari şiələr ümumən əqlin fellərin çirkinliyinə və gözəlliyinə hökm etməkdə aciz olduğunu dedikləri halda, üsuli şiələrindən də bir çox alim etiraf edib ki, nəyin lütf olub olmadığını müəyyən etmək insan əqlinin əhatə dairəsinə daxil deyildir. Bu misallarla qısa bir zamanda tanış olacağıq. Bu mövzunun problemli tərəflərindən biri də insan fellərini Allah üçün müqayisə etməkdədir və imami şiələrinin kitablarında "lütf" mövzusunda bu cür problemli misallarla qarşılaşırıq. Misal üçün əl-Murtəda əş-Şərif "əz-Zəxira" kitabında "lütfün vacibliyi" başlığı altında yazır: "Bizdən birimiz başqasını öz süfrəsinə qonaq çağırarsa, onun gəlişi üçün həmin süfrəni hazırlayarsa və məqsədi dəvət etdiyi qonağa fayda verməkdirsə… fərz edək ki, o, bilir və ya güclü bir şəkildə güman edir ki, (qonağın) üzünə təbəssüm edərsə və ya ona gözəl sözlərlə iltifat göstərərsə və ya oğlunu dəvət etmək üçün göndərərsə və buna bənzər özlüyündə heç bir çətinlik və əziyyət olmayan əməllər edərsə (qonaq) gələcək və geri qalmayacaq və (həmçinin bilir ki,) belə etmədiyi təqdirdə heç bir şəkildə gəlməyəcək, o zaman hələ də dəvət etdiyi kəsin qonaq gəlməsini istəyirsə o zaman bu əməlləri - o əməllər ki, onları etmədiyi təqdirdə qonağın gəlməyəcəyini, etmədikdə qınağa layiq olacağını bilir - etməsi vacibdir."[1677] Bu cür misallar ilə insanlar arasında gözəl və ya çirkin qarşılanan əməlləri göstərmək və daha sonra onların Allah üçün də keçərli olduğunu demək lütf qaydasını etibarlaşdırmaq üçün işlədilən misallardan biridir. Bu misalın özünün insanlar arasındakı münasibətlərdə nə qədər problemli olmasını bir kənara qoysaq, hətta insanlar arasında problemsiz olan hansısa bir misalı belə Allahın fellərində tətbiq etmək nə qədər etibarlı ola bilər?! Ona görə də şiə təfsir alimi Muhəmməd ət-Tabətabəi belə bir yanaşma ilə razılaşmır. O

---

[1676] ət-Tehrani, "Hasrul-İctihad", səh: 46-47;

[1677] əş-Şərif, "əz-Zəxira fi İlm əl-Kələm", səh: 190-191;

yazır: “Bir qrup insanın[1678] etdiyi kimi, əqli Allahın üzərində hakim qılmağımız, beləliklə də … ağılların çıxardığı hökmlər ilə Onu məhdudlaşdırmağımız və ya Onun üçün qanunlar qoymağımız, bununla da fılan felin Ona vacib olduğunu və fılan felin Ona haram olduğunu, fılan felin Onun üçün gözəl olduğunu, fılan felin Onun üçün çirkin olduğunu deməyimiz ən ağır cinayətlərdəndir, çünki nəzəri əqli Onun üzərində hakim qılmaq Onun məhdud olduğuna hökm verməkdir … əməli əqli Onun üzərində hakim qılmaq isə Onun naqis olduğuna, həqiqətdə vəhmi iddialar olan nisbi qanunlar və qaydalarla Onun üzərində hakimlik etməyə qabil olduğuna hökm etməkdir.”[1679] Aydın olan budur ki, bu şiə alimi bu sözləri ilə mötəzili məktəbini ittiham edir, lakin həqiqət budur ki, imami şiələri özləri də bu məsələdə mötəzili məktəbini  davam etdirirlər.

Mötəzililər lütf qaydasını ümumilikdə peyğəmbərlik məqamını isbat etmək üçün işlətdikləri halda imamiyyə məktəbi bu qaydaya əsaslanaraq imamların mövcudluğunu isbat etməyə çalışır. Bu bizə qaydanın birinci müqəddiməsində də şiddətli ixtilafın olduğunu göstərir. Nəyin lütf olduğunu insanlar necə müəyyən edə bilərlər? Biz hələ lütfün Allaha vacib olduğunu iddia etmədən əvvəl hələ birinci müqəddimədə müəyyən bir şeyin lütf olduğunu isbat etməliyik. Fərqli məktəbləri ilə birlikdə sünnət əhli, həmçinin mötəzililər və xaricilər imamların göndərilməsini lütf hesab etmirlər. Yalnızca imamiyyə məktəbinin nümayəndələri inanırlar ki, imamların göndərilməsi Allahın üzərinə vacib olan bir lütfdür. Beləliklə də insan əqli nəyin Allah nəzərində lütf olub, nəyin lütf olmadığını müəyyən etməkdən acizdir, buna görə də ixtilaf etmələri təbiidir. Hətta lütf qaydasını qəbul edən mötəzili və imami məktəbləri belə öz aralarında nəyin lütf olmasında fikir ayrılığındadırlar. Bağdadlı mötəzilənin nümayəndələrindən olan Bişr bin əl-Mutəmir lütf qaydasını qəbul etməyən alimlərdən olub. O deyib: “Allahın qadir ola biləcəyi lütfün heç bir sonu yoxdur və Allah qatında elə lütf vardır ki, indiyə qədər etdiklərindən daha salehdir, lakin etməyib; əgər etsəydi insanların hamısı məcburi olaraq yox, könüllü olaraq iman edərdilər. Onlara lütfündən elə bir miqdar verib ki, insanlar

---

[1678] Kəməl əl-Heydəri qeyd edir ki, ət-Tabətabəi’nin təfsirinin orijinal farsca olan versiyasında burada “mötəzililər” sözü keçməkdədir. Yəni ət-Tabətabəi mötəzililərin öz ağıllarına əsaslanaraq Allah üçün nəyin vacib, nəyin haram olduğunu söyləməklərini tənqid edir, bunu ağır cinayətlərdən hesab edir. Lakin ərəbcə tərcümədə “mötəzililər” hissəsini sadəcə “bir qövm” olaraq tərcümə ediblər.

[1679] ət-Tabətabəi, “əl-Mizən fi Təfsir əl-Quran”, 8/55;

mükəlləf olduqlarını etməyə qadirdilər."[1680] Bu o deməkdir ki, lütf əgər - mötəzililərin və imamilərin iddia etdikləri kimi - Allaha vacib olsaydı, qulların Allahın üzərindəki haqqı olsaydı o zaman bizim sonsuz sayda lütf görməyimiz gərəkəcəkdi. Halbuki belə bir halı müşahidə etmirik. Misal üçün şiələr iddia edirlər ki, imamlar məsumdurlar, günah etməzlər, Allah onlara elə elm əta edib ki, onunla haqqı batildən ayıra bilirlər. Bununla belə onlar robot deyillər, öz seçimləri ilə Allaha ibadət edən insan övladlarıdılar. Məgər Allahın bütün bəşəriyyəti imamlar kimi yaratması bir lütf olmazdımı?!

İmamiyyə məktəbinə gəldikdə isə onların içindən bəzi alimlər lütf qaydasını fərqli şəkildə tənqid ediblər. Bu alimlərdən biri Əhməd bin Mehdi ən-Nəraqi[1681] (h. 1185-1245) "Avaidul-Əyyəm" kitabında lütf qaydasını ənənəvi üslubdan fərqli şəkildə tərif edir: "Onların "lütf" ilə muradı ya 1) hər haqq sahibinə haqqını, yəni layiq olduğunu verməkdir, ya 2) məsləhətləri və fəsadları bəyan etməkdir, ya da 3) mütləq olaraq ihsan, ikram və nemətləndirmədir və yaxud da 4) bəndəni Ona yaxınlaşdıranları və Ondan uzaqlaşdıranları bəyan etməkdir və ya bütün bunlara yaxın bir mənadır." Lütf qaydasının izahı olaraq fərqli variantlar təklif etdikdən sonra ən-Nəraqi deyir ki, "Lütfün bu mənalardan bəziləri olaraq Allahın üzərində vacib olmasında şəkk olmamalıdır, misal üçün birinci və ikinci məna, hətta digər mənalar da bütün növləri ilə olmasa da, icmali olaraq Allahın üzərinə vacibdir…" Beləliklə də başa düşürük ki, ən-Nəraqi Allahın Öz hikməti və ya ədaləti və ya ihsanı gərəyi olaraq hansısa lütf növlərinin - əhatəli və ya mücməl olaraq - Allahın üzərində vacib olduğuna iman edir. Lakin qeyd edir ki, "bunun vacib və ya qeyri-vacib olduğunu isbat etmək və ya onlardan hansının Allahın üzərində vacib olduğunu, hansının vacib olmadığını bəyan etmək bizim buradakı məqsədimiz deyildir. Lakin (buradakı) mətləb onların bu qaydaya istinad etdikləri məsələlərdə bu qaydaya istinad etməyin doğru olmadığını bəyan etməkdir və bunun bir çox səbəbi var."[1682] Beləliklə də şiə alimi ən-Nəraqi ümumilikdə lütfün Allaha vacib olması fikri ilə məşğul olmağı doğru görmür və əvəzində qeyd edir ki, hətta doğru olsa da bunun tətbiqi doğru deyildir. Daha sonra bu səbəbləri izah etməyə başlayan ən-Nəraqi birinci səbəbdə yazır: "Fəsadı və məsləhəti bəyan edərkən Allaha vacib olan onların realda (yəni Allahın tam elminə müvafiq şəkildə) necə olduğunu bəyan

---

[1680] əl-Əşari, "Məqalət əl-İsləmiyyin", səh: 2/574; Mətbəətud-Dəvlə, İstanbul, 1930;

[1681] Şiələrdə Kəşən şəhərindəki elmi hövzənin banisi Mehdi ən-Nəraqi'nin oğludur.

[1682] ən-Nəraqi, "Avaidul-Əyyəm", 2/257; Darul-Hədi

etməkdir yoxsa bizim öz bildiklərimizə uyğun olacaq şəkildə - bildiklərimizin reallığa uyğun olub olmadığından asılı olmayaraq - məsləhət və ya məfsədəni bəyan etməkdir?" ən-Nəraqi burada epistemologiya sahəsinə daxil olur və numena ilə fenomena arasındakı fərqə diqqət çəkir; **numena** varlığın həqiqi formasıdır, Yaradıcının elminə müvafiq olan şəklidir, **fenomena** isə onun bizə görünən versiyasıdır. "Əgər birinci mənanı qəsd edərsə" - ən-Nəraqi deyir: "bunun vacib olduğunu qəbul edərik, vacibliyinin sabit olmasında onlarla mübahisə etmərik, lakin deyərik ki, bu qayda ilə isbat etmək istədiyiniz şeylərin həqiqətən də vaqeədə/reallıqda Allahın elminə müvafiq olduğunu hardan bilirsiz? Bizim (məhdud) elmimiz ilə onu bilməyin yolu nədir?" Beləliklə də əgər Allaha vacib olan lütfün Allahın lütf olaraq bildikləri şeylər olduğunu iddia edirlərsə bunda ən-Nəraqi bir problem görmür, lakin problem gördüyü tərəf budur ki, o lütfün nə olduğunu bizim bilmək imkanımız yoxdur. Bizim öz elmimiz çərçivəsində lütf hesab etdiyimiz isə bəlkə Allahın elmində lütf deyildir. ən-Nəraqi daha sonra buyurur: "Yox əgər onlar ikinci mənanı, yəni bizim öz anlayışımıza, öz idrakımıza və öz elmimiza uyğun olan mənadakı lütfün vacibliyini qəsd edirlərsə soruşarıq: "Bunun Allahın üzərində vacib olmağının dəlili nədir?!"[1683] Daha sonra ən-Nəraqi qarşı tərəfin Quran və sünnətdən gətirdikləri dəlillərdə keçən "lütf" kəliməsinin möhtəməl mənalarına toxunur və qarşıya qoyulan dəlillərin yetərsizliyini, natamamlığını izah edir. Lütf qaydasının doğru olmadığını göstərən ikinci səbəb isə lütfün "qeydsiz və şərtsiz" yoxsa "tələb və maneə şərti ilə" izah olmasındadır. "(Lütf Allahın üzərində) onu qəbul edən tərəfdən bunu gərəkdirəcək səbəbin olması və ya qəbul edən tərəfdən maneələrin olmaması və ya (ümumən) kənar maneələrin olmaması şərti ilə mütləq olaraq vacibdir yoxsa bu şərtlər vardır? Əgər birincini qəsd edərlərsə bunun fasid olması bədahətən bilinən bir şeydir, çünki hər bir şeyin baş verməsi üçün onu gərəkdirən səbəblərin olması və maneələrin olmaması şərti zəruridir və üstəlik belə bir (qeydsiz-şərtsiz) lütfün Allaha vacib olmasının dəlili nədir?! Əksinə gərəkdirici səbəbin olmaması və ya maneənin olması bunun lütf ola bilməyəcəyini tələb edir. Üstəlik müşahidə etdiklərimiz və gözümüzlə gördüklərimiz bunu yalanlayır; çünki lüft olduğunu qəti olaraq iddia etdikləri o qədər işlər var ki, xarici aləmdə baş verməyib, reallaşmayıb…" Beləliklə də lüft olduğunu düşünmüyümüz işlərin Allahın üzərində heç bir şərt olmadan vacib olduğunu demək batildir. O zaman ikinci seçim qalır,

[1683] ən-Nəraqi, 2/257-258;

yəni bu lütfün vacibliyi onu gərəkdirən səbəblərin mövcud olması və maneələrin aradan qalxması ilə şərtlidir. Bu haqda ən-Nəraqi deyir: "Əgər ikinci mənanı, yəni hər bir feldə onu gərəkdirən səbəbin olması və daxili və xarici maneələrin aradan qaxlması şərti ilə lütfün Ona vacib olduğunu qəsd edirlərsə, o zaman bu qayda əslən bizə heç bir yerdə fayda vermir, çünki bu qaydaya ehtiyac olan istənilən məqamda onun gərəyi ilə hökm vermək onu gərəkdirən bütün səbəblərin varlığından və ona mane olacaq bütün səbəblərin yoxluğundan xəbərdar olmağımızdan asılıdır. Bunu bilməyimiz isə əşyaların və fellərin zatlarını, onların həqiqətlərini, bütün daxili, xarici, maddi və mənəvi işləri bilməyimizdən asılıdır. Halbuki biz (şəriətdə) elə gərəkdirici səbəblər və maneələr görürük ki, onu dərk etmək mümkün deyildir." Daha sonra ən-Nəraqi buna bəzi misallar verir. Misal üçün şiələr mükəlləfin mükəlləfiyyət yaşına girməyini lütf adlandırırlar, lakin erkək uşaqların üçün bunun 15 yaşın tamamlanması ilə baş verdiyi deyilir, nə üçün 14 yox? Nə üçün 15 yaş olmadan bir gün əvvəl bu lütf deyildir? Nə üçün qızlardan bu 9 yaşdır? Yaxud da peyğəmbərlərin göndərilməsi lütfdür, lakin nə üçün misal üçün bizim peyğəmbərimizə peyğəmbərlik verildiyi gün yox, ondan bir gün əvvəlki gün lütf deyildi? Yəni ən-Nəraqi bu misallarla göstərmək istəyir ki, biz şəriətdə bəzi "gərəkdirici səbəbləri bilirik", lakin onların nə üçün gərəkdirici səbəblər olduğunu dərk edə bilmirik. "Üstəlik onlar özləri deyirlər ki, Allah ən məsləhətli olanın nə olduğunu bilməsi gərəyi ilə kainatları ayandan və fellərdən icad edib və Allah bir şeyin icadını təxirə salırsa və ya bir şeyin vaxtını tezləşdirirsə yenə bunu nəyin ən məsləhətli olduğunu bilməsi gərəyi ilə edir. Ola bilsin ki, sənin lütf hesab etdiyinin Allahın bildiyi daha məsləhətli bir halın gərəyi ilə təxir edilməsi lazımdır və ya ümumiyyətlə yaradılmaması lazımdır. Görünən budur ki, sən bütün ayan və fellərdə Allahın bildiyi kimi nəyin ən məsləhətli olduğunu bildiyini iddia etmirsən. Əgər bilmədiyini etiraf edirsənsə o zaman fılan felin fılan vaxtda Allaha vacib olması və ya vacib olmaması haqqında etdiyin bu yersiz söhbətlərin mənası nədir?!"[1684]

Üçüncü səbəbə başlayarkən ən-Nəraqi deyir: "Bizim lütf olduğunu iddia etdiyimiz bir şeyin yerinə keçə biləcək başqa bir şeyin baş verməsi mümkündürmü? Əgər "bəli" desən soruşacağıq: Sən hardan bilirsən ki, lütf qaydası ilə isbat etmək istədiyin hər bir məqamda onu əvəz edəcək bir başqa iş onun yerinə keçməyib?! Əgər "xeyr" desən, zəruri

---

[1684] ən-Nəraqi, 2/259-261

hal və qəti icma səni yalanlayır, çünki real hökmlər qullarına nisbətdə Allahın lütfləridir və onları əvəz edənlər isə, müctəhidlərin nəzərlərinə əsaslanan ixtilaflı zahiri hökmlərdir." ən-Nəraqi demək istəyir ki, şəriətdə bir çox hökmlər var ki, müctəhidlər onların haqqında ixtilaf ediblər və biz o işlərin Allah nəzərindəki həqiqi, batini hökmlərini bilmirik və Allahın qullarına olan lütfləri həmin həqiqi, batini hökmlərdir. Lakin biz onları bilmədiyimiz üçün şəriətimizdə onları əvəz edən zahiri hökmlər verilib. Dördüncü səbəbə gəldikdə isə ən-Nəraqi buyurur ki, "biz əşyalarda və fellərdə lütf olduğuna dair qəti qənaət sahibi olduğumuz şeylər görürük… lakin bununla belə (həmin lütf) baş verməyib." Buna misal verərək deyir: "Misal üçün imamın zühuru və təsərrüfü, beləki biz onun lütf olduğunu qəti olaraq bilirik, amma onun bu günlərdə sözünü açıq şəkildə deyən, zəlalətdən qurtaran, qılıncını qınından sıyırmış, Allah tərəfindən dəstək görmüş bir imam olaraq çıxması ilə daha sonra zühur etməsi arasında fərq görmürük, hətta onun mücərrəd olaraq zühur etməsi ilə on birinci imamın öz zamanında, hətta peyğəmbərin göndərilməsi arasında bir fərq görmürük."[1685] Başqa sözlə desək əqlən bu hallardan hansının lütf olduğunu müəyyən etmək olmur. ən-Nəraqi'nin sözünə qüvvət olaraq belə bir sual verə bilərik. Bizim bu zamanımızda məsum imamın müsəlmanların arasında olması, onlara ixtilaflarında yol göstərməsi, onlara müsibətlərində dəstək olması lütfdürmü? Əgər "lütf deyildir" cavabı verilsə deyəcəyik ki, o zaman eyni şəkildə peyğəmbərdən – aleyhissələm – sonra da hansısa bir imamın olması lütf deyildir. Əgər "lütfdür" cavabı verilərsə o zaman nə üçün bu lütf baş verməmişdir sualı ortaya çıxacaq. Beləliklə də ən-Nəraqi bu dörd səbəbə əsaslanaraq lütf qaydasının tutarlı olmadığını, doğru olmadığını göstərmiş oldu. ən-Nəraqi'nin bu yanaşmasının eynisini Cəvadi əl-Əmuli də müdafiə edirr.[1686] Bu yanaşma ümumən lütfün Allaha vacibliyini inkar etmir, lakin insan əqlinin nəyin lütf olub olmadığını bilməkdəki acizliyinə işarə edir. Bu acizlik Kəfh surəsində Musa peyğəmbər ilə Xızırın yoldaşlığında baş vermiş hadisələrdə özünü əks etdirir, beləki Musa peyğəmbərin çirkin hesab etdiyinin həqiqətdə gözəl bir şey, başqa cür desək lütf olduğu Xızır tərəfindən göstərilir. Sonra hər ikisi yola düzəlib getdilər. Nəhayət (gəlib) gəmiyə mindikləri zaman (Xızır) onu deşdi. (Musa) dedi: "Sən gəmidə olanları suya qərq etmək üçünmü onu deşdin? Doğrusu, (günahı) böyük olan bir iş gördün". (Xızır) dedi: "Mən

[1685] ən-Nəraqi, 2/261
[1686] Abdullah Cəvadi əl-Amuli, "Vilayət Fəqih", səh: 416

deмədimmi ki, sən mənim yanımda səbr edə bilməzsən?" (Musa) dedi: "Unutduğum bir şeydən ötrü məni qınama və öz işimdə məni çətinliyə salma!". Yenə yola düzəldilər. Nəhayət, bir oğlan uşağı ilə rastlaşdıqda (Xızır) onu öldürdü. (Musa) dedi: "Heç kəsi öldürməyən günahsız bir canamı qəsd etdin? Doğrusu, çox pis bir iş tutdun". (Xızır) dedi: "Sənə demədimmi ki, mənim yanımda səbr edə bilməzsən?" (Musa) dedi: "Əgər bundan sonra səndən bir şey barəsində soruşsam, daha mənə yoldaş olma. Sən artıq mənim diləyəcəyim (sonuncu) üzrxahlığa çatdın". Yenə yola düzəldilər. Nəhayət, bir kənd əhlinin yanına gəlib camaatdan yeməyə bir şey istədilər. Camaat onları (yeməyə) qonaq etmək istəmədi. Onlar orada dağılmaq istəyən bir divar gördülər. (Xızır) onu düzəltdi. (Musa) dedi: "Əgər istəsəydin, bunun müqabilində zəhmət haqqı alardın". (Xızır) dedi: "Bu, mənimlə sənin aranda ayrılıqdır. Səbr edə bilmədiyin şeylərin yozumunu sənə xəbər verəcəyəm. Gəmiyə gəlincə, o, dənizdə çalışan kasıb adamlara məxsus idi. Mənim onu korlamağımın səbəbi, onların önündə hər bir (yararlı) gəmini zorla ələ keçirən hökmdarın olması idi. Oğlan uşağına gəldikdə, onun ata-anası mömin idilər. Biz (uşağın böyüyəndə) onları azğınlığa və küfrə sürükləməsindən qorxduq. Biz istədik ki, onların Rəbbi onun əvəzində onlara ondan daha təmiz və daha mərhəmətli olan (başqa)(bir)(övlad) versin. Divara gəldikdə isə, o, şəhərdəki iki yetim oğlanın idi. Altında onlara məxsus bir xəzinə vardı. Onların atası əməlisaleh adam olmuşdur. Rəbbin onların həddi-buluğa çatmalarını və Rəbbindən bir mərhəmət olaraq öz xəzinələrini (tapıb) çıxartmalarını istədi. Mən bunları öz ixtiyarımla etmirdim. Sənin səbr edə bilmədiyin şeylərin yozumu budur!" (Kəhf, 71-82)

Lütf qaydasının əsassız və tutarsız olduğunu söyləyən şiə alimləri təkcə ən-Nəraqi və əl-Əmuli olmayıb. Bunu etiraf edən və lütf qaydasını əsassız hesab edən şiə alimləri arasında Əbul-Qasim əl-Xoyi də var. O, "Misbəh əl-Usul" kitabında yazır: "Bu qayda özlüyündə tutarlı deyildir, çünki lütf Allaha vacib deyildir; o lütf ki, onu tərk etmək, Allahdan sadir olması imkansız olan çirkin bir fel sayılacaq. Əksinə Allahdan sadir olan hər bir şey sadəcə qulları üzərində fəzl və rəhmətdir."[1687] Məlumdur ki, lütf qaydasının "intellektual gücü" bundan ibarətdir ki, Allah insanları yaradıbsa onlara nə üçün yaratdığını izah edəcək, onlara doğru olanları bəyan edəcək peyğəmbərləri və ya imamları göndərməzsə bu, Onun hikmətinə və ya ədalətinə zidd olar. Ədalətə və hikmətə zidd bir fel

---

[1687] "Məcmuatul-İmam Xoyi", 47/161; Muəssəsə əl-Xoyi əl-İsləmiyyə, 2009 və ya əl-Xoyi, "Misbəh əl-Usul - Təqrir Bəhs əl-Xoyi lil-Bəhsudi", 2/138;

etmək isə çirkindir. Allah isə çirkin olanı etməz, beləliklə də Allahın peyğəmbərlər və ya imamlar göndərməsi vacibdir. əl-Xoyi gördüyümüz kimi bu arqumenti əslən batil hesab edir. Mustafa əl-Xumeyni də eyni rəydədir və üsul kitablarının birində deyir: "Lütf qaydası nə nübuvvət babından, nə də imamət babında tutarlı deyildir, bunun təfsilatı başqa yerdədir."[1688] Lakin təəssüf ki, bu təfsilatı haqqında hardasa məlumat verdiyini görmədim. əl-Xoyinin dediklərinin bənzərini Taqi ət-Tabətabəyi əl-Qummi də deyir və xüsusilə vurğu edir ki, "biz ağıllarımız bu işləri dərk etmək və Allaha nəyin vacib olduğunu müəyyən etmək qabiliyyətinə malik deyildir…"[1689] Həmçinin Muhəmməd Kazim əl-Xurasəni "Kifəyətul-Usul" kitabında lütf qaydasının "batil" olduğunu yazır[1690] Bu sözlərin haşiyəsində Mirzə Əbul-Həsən əl-Mişkini yazır: "Lüftün vacibliyinin əqlən imkansız olması səbəbilə qayda batildir, necəki xeyli məqamlarda lütfün baş vermədiyinə şahid oluruq. Əks təqdirdə ortaya çıxan nəticə bu olar ki, Allaha və ya məsumlara vacib olan lütfü etməyiblər; Allah və övliyaları bu ittihamdır münəzzəhdir."[1691]

Bu mövzu barəsində danışmış və lütf qaydasının batilliyini bəyan etmiş daha iki şiə alimi və onların sözləri ilə tanış olaq. Bunlardan birincisi əl-Xoyi'nin tələbəsi Muhəmməd Asif əl-Muhsini'dir (1935-2019) və o yazır: "Lütfün Allaha vacib olduğunu deyənlər və Allaha imam təyinatını vacib görənlər üçün sonuncu imam məsələsində problemlə üzləşirlər, çünki Mehdinin qeybətə çəkilməsi Allahın Öz üzərində olan vacibi yerinə yetirmədiyi nəticəsini gərəkdirir. əl-Muhəqqiq ət-Tusi "ət-Təcrid" kitabında buna cavab olaraq yazır: "Onun varlığı bir lütfdür, təsərrüfü isə bir başqa lütfdür. (İmamın halhazırda) bizimlə olmaması bizdəndir." əl-Alləmə əl-Hilli şərhində bunu açıqlayaraq deyir: "İmamın mövcud olması özlüyündə bir lütfdür və bunun bir neçə izahı var: Birincisi budur ki, o, şəriət qaydalarını ora bir şeyin əlavə edilməsindən və ya oradan nəyinsə çıxarılmasından qoruyur. İkincisi: mükəlləflərin imamın var olduğuna, onun hökmünün bütün zamanlarda onların üzərində keçərli olmasına etiqad etmələri fəsaddan uzaq durmaqlarının, islaha yaxın olmaqlarının səbəbidir[1692]

---

[1688] Xumeyni, "Təhrirat fil-Usul", 6/359;

[1689] əl-Qummi, "Arauna fi Usul əl-Fiqh", 2/86;

[1690] əl-Xurasəni, "Kifəyətul-Usul", səh: 291; Muəssəsə Al əl-Beyt, Beyrut, 2008

[1691] "Kifəyətul-Usul", əl-Mişkini haşiyəsi ilə, 3/246-247;

[1692] Burada əl-Hilli qeybdə olan imamın hələ də faydası olduğuna izahat gətirməyə çalışır. İddiası budur ki, imam qeybə çəkilmiş olsa belə şiələr onun varlığına etiqad etdikləri

və bu, zəruri olaraq bilinən bir şeydir. Üçüncüsü: onun təsərrüfünün lütf olmasında şəkk yoxdur və bu, yalnız imamın var olması ilə mümkündür, beləliklə də var olması özlüyündü bir lüft olur, təsərrüfü isə bir başqa lüft olur." Deyirəm: Bu izahlar zəifdir, çünki qəti olaraq bilirik ki, şəriəti (əlavələrdən və nöqsanlardan) qorumaq imamın sadəcə varlığı ilə yox, təsərrüf etməsi ilə hasil olur. Üstəlik əlavələrin və nöqsanların şəriətdə baş verdiyini yəqinliklə bilirik; bu ya saleh, müctəhid və adil ravilərin bilmədən səhv etməsi ilə, ya da şər əhlinin, yalançıların və hədis uyduranların qəsdən etməsi ilə baş verib, onda imam şəriəti necə qoruyur?! Qorumağın - zahirdə - mənası budur ki, mükəlləf olanlar ona sual versələr onlara cavabı heç bir ziyadə və nöqsan olmadan bəyan edər, lakin bunun imamın qeybəti müddətində imkansız olduğunu zəruri olaraq bilirik.

İmamın var olduğuna, ona tabeçiliyin vacib olduğuna etiqad etmək, elmi ilə hər şeyi əhatə edən, xain baxışları və qəlblərin gizlətdiklərini bilən, mükəlləflərin özünə şah damarlarından da yaxın olan Allahın varlığına etiqad etməyin üzərinə yeni bir şey əlavə etməz. (İmama etiqadın) Allahın etiqadından doğan halın üzərinə əlavə bir təsiri ola bilməz. Özü də bunun zəruri olaraq belə olduğunu demək daha əvvəl eşidilməmiş bir iddiadır.

Bəli! İmamın insanların arasında olması və onun gözlə görülməsi insanların əksəriyyətini günahlardan çəkindirə, onları xeyrə yaxınlaşdıra bilər, çünki insanlar - az qismi istisna - əqli şeylərdən daha çox fiziki olanlardan daha çox təsirlənirlər; biz bunu onların alimlərlə qarşılaşmaqlarından təsirlənməklərində müşahidə edirik. İmamın varlığının onun təsərrüfünə - ki, bu bir lütfdür - bir müqəddimə olmasına gəldikdə isə bundan şəkk yoxdur, lakin bu, imamın mövcudluğunun özlüyündə bir lütf olmasını gərəkdirməz, çünki müqəddimə ilə onun zeyli arasında zəruri bir ayrılıq vardır. Beləki dəstəmaz namazın müqəddiməsidir, namazın özü deyildir. Bununla belə bu təlfiqin ifadə etdiyi məna budur ki, imamın varlığı təsərrüf etdiyi təqdirdə lütfdür, əks təqdirdə lütf olmaz. Qeybət zamanında isə imamın

---

müddətdə fəsad işlərdən bacardıqları qədər uzaq duracaqlar, xeyir işlər görməyə həvəsli olacaqlar. Qəribədir ki, hər şeyi Görən, gizli olanları Bilən Allahın varlığına inanmaqları insanları fəsaddan uzaq tutmağa, xeyrə yaxınlaşdırmağa yetmirsə, hansısa imamın qeybdə olması necə fayda verəcək? Yoxsa şiələr Allahdan çox imamlardan qorxurlar? Səmimi şiə qardaşlarımız və bacılarımız bunun üzərində düşünməli və başa düşməlidirlər ki, müdafiə olunması mümkün olmayan mövqeləri müdafiə etmək cəhdləri şiə alimlərini absurd ziddiyyətlərə salıb.

təsərrüfünün olmadığı bilinir, o zaman onun varlığının necə lütf olduğu fərz oluna bilər?!" Beləliklə də əl-Muhsini burada etiraf edir ki, şiələrin etiqad etdikləri on ikinci imamın qeybə çəkilməsi ilə lütf qaydası arasında aşkar bir ziddiyyət vardır, çünki insanlara haqqı bəyan etmək üçün imamları göndərmək lütfün gərəyi olaraq Allaha vacibdirsə o zaman Allah bu lütfü yerinə yetirməyib, çünki sözü gedən imam qeybətdədir, insanların arasında deyildir. Daha sonra əl-Muhsini həm Nəsuriddin ət-Tusi'nin, həm də əl-Hillinin bu problemi həll etmək üçün verdikləri cavaba toxunur və bu cavabların zəif olduğunu çox aydın şəkildə nümayiş etdirir. Daha sonra buyurur: əl-Alləmə (əl-Hilli) daha sonra deyir: "Burada mühəqqəq olan bu cür deməyimizdir ki, imamlıqdakı lütf bir neçə işlə tamamlanır. Bunlardan biri Allaha vacib olandır və bu, imamı yaratmaq, ona qüdrət və elm ilə imkanlar vermək və onu adı ilə elan etmək və təyin etməkdir. Bunu isə Allah yerinə yetirib. Bir digəri isə imamın üzərinə vacib olandır və bu, imamlıq vəzifəsini üstlənmək və onu daşımaqdır. Bunu imam yerinə yetirib. Bunlardan üçüncüsü isə rəiyyənin üzərinə vacib olandır və bu, imama kömək etmək və ona dəstək olmaqdır, onun əmrlərini qəbul etmək, sözünə tabe olmaqdır. Bunu isə rəiyyə etməyib, beləliklə də onların lüftün kamilliyindən məhrum olmaqlarının səbəbi nə Allah, nə də imamdır, rəiyyə özləridir." Sitatın sonu. Deyirəm: Əsaslandığı arqument özündən əvvəlkilərə tabe olaraq dediyi bu sözdür: "bunu isə rəiyyə etməyib." Biz onlardan soruşuruq: Əgər siz bununla bütün rəiyyəni/insanları qəsd edirsizsə belə bir şey qəti olaraq imkansızdır. Yox əgər insanların bir hissəsini qəsd edirsizsə, o zaman insanların digər hissəsinin günahı nədir? Üstəlik belə bir izahın tələb etdiyi nəticə budur ki, peyğəmbərlər və imamları elə o başdan göndərmək vacib deyildi, çünki insanların hamılıqla peyğəmbərlərdən və imamlardan kiməsə dəstək olduqları görülməyib... Mühəqqəq rəy budur ki, lütf Allaha vacib deyildir..."[1693] əl-Muhsini lütf qaydası ilə on ikinci imamın qeybə çəkilməsi arasında aşkar bir ziddiyyət görür və ət-Tusi, əl-Hilli kimi keçmiş imami alimlərin gətirdikləri izahların əslində izah olmadığını da gözəl anlayır və bunu çox asan üslubda başa salır. Burada ət-Tusi və əl-Hilli'nin verdikləri cavabın tutarsızlığını başqa şəkildə də görmək mümkündür. Onların cavabından belə anlaşılır ki, lütfün praktikada faydası Allahın kimisə təyin etməyindən yox, insanların özlərinin etdikləri seçimdən asılıdır. O zaman reallığa baxdığımızda vəziyyətin əksinə olduğunu görürük. Görürük ki, müsəlmanların

---

[1693] Muhsini, "Siratul-Haqq", 3/364-365;

əksəriyyəti Qurana, peyğəmbərə iman gətirsə də imamlara iman etməyiblər. Bunun məntiqi nəticəsi budur ki, insanlar məsum imam olmadan Allaha ibadət etməyə üstünlük veriblər. O zaman necə olur ki, imam təyinatı Allaha ibadət etməyi insanlar üçün daha asanlaşdırıb?! Reallıq budur ki, imamət inancı və ya imamətin özü ümmətin nə sayına, nə də keyfiyyətinə təsir edib, onlar üçün ibadəti asanlaşdırmayıb. Əksinə, imami şiələr doğru deyirlərsə, yəni imamlara iman etmədən ölənlər əbədi atəşə layiq olurlarsa, onların ibadətləri, itaətləri keçərsiz olursa, bu o mənaya gəlmirmi ki, Allah imamlar təyin etməklə və onlara tabe olmağı tələb etməklə ümmətin işini asanlaşdırmayıb, əksinə çətinləşdirib. Çünki sünnət əhlinin dediyi doğrudursa, yəni Allaha ibadətlərin keçərli olması və Axirətdə qurtuluş üçün Allah və rasulu kifayət edirsə, imamların olması şərt deyilsə o zaman nəticə budur ki, İslam ümmətinin böyük bir hissəsi əməlləri keçərlidir, lakin əgər şiələr doğru deyirlərsə, imamsız Allah və rasulu kifayət etmirsə o zaman insanların əməlləri, ibadətləri asanlaşmır, əksinə çətinləşir. Bunun harası lütf olur?! Allah hər şeyi biləndir və o bilir ki, görünməyən, qeybdə gizlənən bir imamın varlığına, məsumluğuna iman gətirmək insanlar üçün çətin olacaq, asan olmayacaq, belə bir şərt olmadan iman gətirmək daha asan olacaq, o zaman nə üçün ümmətə rəhbərlik edə bilməyəcək, hətta qaçıb gizlənəcək imamları göndərməklə müsəlmanların işlərini çətinləşdirib?! Düşünən bir şiə həmən dərk edər ki, belə bir şərt və belə bir vəziyyət ümumiyyətlə - iddia olunduğu kimi - lütf ola bilməz.

Lakin bütün şiə alimləri fikirlərini bu qədər açıqdan deyə bilmirlər. Bəziləri fikirlərini qələmə tökərək yalnız ölümündən sonra ifşa olunmasını vəsiyyət edir. Bu alimlərdən biri Muhəmməd ər-Rida əl-Muzaffər (1904-1964) lütf qaydası haqqında fikirlərini bu şəkildə ərz edir: "Şiəlik fəlsəfi olaraq… bu günə qədər gözlənilən imamın varlığına əql yolu ilə etiqad etmək asan olsun deyə lütf qaydasına əsaslanır və bu qayda ilə nübuvvət, imamət, peyğəmbərlərin və imamların məsumluğu, hər əsrdə imamın daim mövcud olmasının vacibliyi isbat olunur. Ümumi insanların nəzərində bu qaydanı etiraf etmək iki məsələni ortaya çıxarır ki, onlara aydınlıq gətirməyə bu əsrdə, hətta bütün əsrlərdə şiə alimlərinin əhəmiyyət verməsi vacibdir.

**Birinci**: Dünyanın hər tərəfində yaşayan insanların arasında İslam dininə inanmayanların sayı müsəlmanlardan qat-qat çoxdur. Hələ Amerikanı, Avropanı və Afrikanı bir kənara qoysaq, təkcə Şərqdəki qeyri müsəlmanlar - misal üçün çinlilər, yaponlar, hindlilər və

oradakı adaların əhalisi - müsəlmanlardan on dəfə çoxdur. Islam nurunun doğuşundan bu günə qədər bu çoxluqda insanın hamısına "lütf qaydasının" tələbi olaraq hüccət iqamə olunubmu və risalət çatdırılıbmı, sonra da İslamı qəbul edib boyun əyməkdə inad ediblər və bunların hamısı İslam dininə küfr etdikləri üçün Allahın qatında əzab görəcəklər? Coğrafiya öyrənmiş hər kəsdə təbii olaraq belə bir inkar edici sual asanlıqla formalaşır. Belə görünür ki, din adamlarının coğrafiya dərsinə nifrət etmələrinin arxasındakı sirr budur, yoxsa bu elmin özündə dinə qarşı olacaq heç bir şey yoxdur. Bu gün qəzetlərin və media vasitələrinin geniş yayılması sayəsində bu məlumatlar, aralarında savadsızlar da olmaqla heç kəsə gizli qalmır. Ona görə də - xüsusilə də insanlar bu dəhşətli müharibələrin xəbərləri ilə mübtəla olduqdan sonra - ionların bunları öyrənməklərində qorxulacaq yer təkcə məktəblər deyildir. Sual təkcə bu qədər qorxunc sayda insanın əzabı haqqında olsaydı işimiz asan olardı, lakin İslam dininin arqumentlərinin bütün bəşəriyyətin qulaqlarına çatması nöqtəsində insanlardakı şəkkin güclü olduğu görünür. Əgər lütf qaydası peyğəmbərlərin göndərilməsinin, onların hüccətlərinin insanlara çatdırılmasının vacibliyini tələb edirsə, o zaman İslam dininin hüccətini insaniyyətə çatdırmaqda hansı metodlar işlədilib? Əgər bizə çatdığı kimi onlara da çatıbsa o zaman nə üçün onlar da bizim kimi bu dəvətdən təsirlənməyiblər? Əqli olan lütf qaydasında bir bəşər övladını digərindən istisna etmək mümkün deyildir, ona görə də bu hüccət nə üçün müsəlmanlara çatıb, amma başqalarına çatmayıb? Əgər insanlardan tək bir nəfərə hüccətin çatmadığı, cahil olaraq qaldığı fərz olunarsa, o zaman lütf qaydasının gərəyi olaraq hansı yolla olursa olsun hüccəti ona çatdırmaq Allaha vacib olardı. Hüccətin çatmadığı həmin kəsi əzabdan müaf etməyimiz də problemi həll etmir, çünki sual sahibi daha sonra soruşa bilər: həmin şəxsin əzabdan əfv edildiyi fərz edilsə belə, hüccət ona çatdırılmadığı üçün o, Allahın nemətindən, İslam dinini bilməkdən məhrum edilmiş olur, halbuki fərz olunanan görə İslam dini Allah tərəfindən bir lütfdür. Əgər belə bir hal bir şəxs üçün mümkündürsə, bütün bəşəriyyət üçün də mümkündür, o zaman belə çıxır ki, Allahın elçilər göndərməsi və insanlara əzab verməsi mümkündür. Bizim bu məsələ dəvəti bütün insaniyyətə çatdırmaqda din adamlarının və İslam dəvətçilərinin təqsirinin olması məsələsi deyildir, beləki lütf qaydası hökm edir ki, mövcud insanlar qüsur göstərsələr və ya aciz buraxılsalar, hər kəsə - hansı yolla olursa olsun - dəvəti çatdıracaq şəxsləri yaratmaq və ya təyin etmək Allaha vacibdir. Ona görə də bizim bu əsrdə şiə alimlərdən kəlamçılara bu problemi həll

etmək vacibdir, yoxsa onların lütf qaydası təhdid altında qalacaq. Alimlərimizin kitablarında bu baxımdan susuzluğumu aparacaq bir şey tapa bilməmişəm. Bunun qəlbimi ağrıtdığını etiraf edirəm. Əgər sərt şərtləri olan lütf qaydasından güzəşt etmək istəsələr, bəlkə də risalət təbliğinin vacibliyindən insanların bir hissəsini istisna edəcək şəkildə yüngülləşdirə bilərlər. Mən şəxsən bu nöqtə üzərində düşünəcəm, bəlkə də qarşıda bu mövzuya qayıtmaq üçün münasib məqamlar çıxacaq."[1694] Şeyx Muhəmməd Rida əl-Muzaffər'in burada qarşıya qoyduğu problem "lütf qaydası" ilə müşahidə etdiyimiz tarixi-ictimai reallıqdır. Əgər ədalət və ya hikmət və ya ikram və yaxud da ihsanın gərəyi olaraq bəşəriyyətə onların yaradılış qayəsini izah edən, onlara dünyəvi və uxrəvi məsləhətləri və fəsadları öyrədən peyğəmbərlər, imamlar göndərmək vacib olsaydı, o zaman nə üçün bu qədər insan kütləsi bu lüftdən məhrum olub? Cənubi Amerikanın amazonlarından tutmuş Yeni Qvineyanın meşələrinə qədər bir çox yerdə keçmişlərinə sadiq şəkildə yaşayan qəbilələr vardır ki, onlar bu lütfün əsər-əlamətini görmürlər. Təkcə Yaponiyanı götürsək, İslam dininin zühurundan bəri çox məhdud bir şəkildə və məhdud bir zamanda İslam dəvətinə məruz qalıb. əl-Muzaffər etiraf edir ki, onda bu problemi həll etmək üçün bir cavab yoxdur və belə bir cavabı şiə kitablarında tapa bilməyib. Daha sonra ikinci problemə toxunan Muhəmməd Rida əl-Muzaffər yazır:

"**İkinci**: Lütf qaydasını sarsıdan tərəflərdən biri də gözlənilən İmamın bu qədər uzun müddətdə gizli qalmasıdır. Çünki daha əvvəl də qeyd etdiyimiz kimi qayda hər kəsə dəvətin çatdırılmasına hökm edir. O zaman İmamın dəvətini hər kəsə çatdıracaq kifayət edici metodlar hansılardır və onun varlığının dəlili nədir? Üstəlik əgər bu qayda, bəşəriyyətin hidayəti üçün mövcud bir imamın təyin olunmasını tələb edirsə, o zaman bütün aləmi zəlalətlər, zülmlər və məfsədələrin bürüdüyü halda heç kimsənin, hətta öz tabeçilərinin belə ona çata bilmədiyi şəkildə gizlində mövcud olmasının nə faydası var?! Qarşıya qoyulan üzr budur ki, imamı özlərindən qorxudaraq onun gizlənməsinə səbəb olanlar insanlar olublar, beləliklə də özləri özlərini məhrum ediblər. Əgər arqument xatirinə belə bir üzrü qəbul etdiyimiz fərz etsək, bu o deməkdir ki, bunun vəbalı imamın əsrində yaşamış və onun gizlənməyinə səbəb olmuş insanların boynundadır, bəs ondan sonrakı əsrlərdə yaşamış insanların günahı nədir?! "Heç bir günahkar başqasının günahını daşımaz." (Ənam, 164) Əgər üzr gətirənlər, imam

---

[1694] "əş-Şeyx Muhəmməd Rida əl-Muzaffər əl-Fəlyəsuf val-Mufəkkir əl-İraqi əl-Kəbir", səh: 79-81; Kufa Academy, 2022

zühur etdiyi təqdirdə bütün bu əsrlər ərzində insanların onu öldürəcəklərini və ona tabe olmayacaqlarını deyərlərsə bu, miskin bəşəriyyəti batilcəsinə ittiham etməkdir. Belə bir hökmün təcrübəyə və qeyb elminə ehtiyacı var. Əgər lütf qaydası, imam təyin etməklə insanlara hidayət verməyin vacibliyini Allaha vacib görürsə və bu imam təkcə on ikinci imamın şəxsi ilə məhduddursa, o zaman ya zühurunu qarantiyaya alacaq yolları hazırlamalı, ya da bir başqasının şəxsində zühur etməsini sağlamalı, ya da ki lütf qaydası özü batildir.

Gümanım budur ki, bu qayda kəlamçıların çıxardıqları, hazırladıqları bir şeydir; hər bir şeyi əqli qaydalar üzərinə oturtmaq istədilər, lakin uğursuz oldu. Üstəlik bu, heç bir zərurət olmadan Allah üzərində hökm qoymaqdır. Məxluqat Allahın qatında rəhmət və lütf baxımından eyni bərabərdədir, beləliklə də rəhməti və lütfündə onlardan bəzilərini digərlərindən ayırmır. Bəli, əqlin verdiyi hökmə görə Allahın qullarına lütf etməsi labüddür və göndərdiyi şəriət lütfün bir növüdür. Lakin biz hardan bilirik ki, hər bir kəsə şəriətin hökmlərini çatdırmaq vacib olan lütfdür?! Hardan bilirik ki, lütf, mövcud olan kəsə İslamın təbliğ olunması ilə münhəsirdir və imamın təyin olunması, onun hər əsrdə və yerdə zühur etməsi vacib lütfdəndir?! Əqli ümumi qayda (yəni lütfün ümumilikdə vacibliyi) zəruri olaraq doğrudur, lakin şəkk lütfün ilk müqəddiməsindədir; yəni fılan şeyin lütf olduğunu, fılan şeyin isə lütf olmadığını deməkdədir. Ola bilsin ki, insanlara olan lütfün gərəyi onları dinlərində müxtəlif etməkdir, yaşayış tərzlərində fərqli etməkdir; necəki bu, qədim zamandan günümüzə qədər bir reallıq olaraq qalıb. İmamın da gizlənməsi və zühur etməməsi lütfdən ola bilər. İstənilən halda lütf qaydası ilk müqəddimələrinə tətbiqatında elə bir əqli bədihi qayda deyildir ki, bütün insanlar üçün hansısa dini və ya məzhəbi qəbul etməyin xeyrinə hüccət olaraq yarasın.

Sözümüzün canı budur ki, lütf qaydası ümumilikdə, yəni əqli bir müqəddimə olaraq məqbuldur, üzərinə toz qondurula biləz, şəri olaraq da belədir; yəni müqəddəs Quran birmənalı olaraq deyir ki, "Allah öz qullarına qarşı Lütfkardır." Məsələnin mübahisəli tərəfi, şəkk götürən tərəfi nəyin lütf olduğunu müəyyən etməkdədir; yəni bu külli qaydanın ilk müqəddimələrindədir. Daha əvvəl dediyimə bir daha qayıdıram və təkrar edirəm ki, kəlam əhli, öz dininin və ya məzhəbinin xeyrinə arqument qurmaq məqsədi ilə bu qaydaya sığınmaqla özlərini dolaşığa salıblar. Halbuki bizim imam əs-Sadiq'in dediyi kimi "Dinə ağıllarla isabət edilməz."..." Muhəmməd Rida əl-Muzaffər bu fikirlərini bu cümləsi ilə tamamlayır: "Sonunda açıq-aşkar bəyan edirəm ki,

nübuvvət və imamət məsələlərində dəlil gətirmək üçün lütf qaydasına etibar etmirəm…”[1695]

Beləliklə də bu şiə alimlərdən gətirdiyimiz sitatlar vasitəsilə lütf qaydasının çox problemli, nəzəri tərəfdən zəif bir qayda olduğunu göstərmiş olduq. Çünki əgər şiə alimləri özləri öz aralarında “əqli dəlil” adlandırdıqları bu dəlilin üzərində razılaşa bilmirlərsə, başqalarından bu dəlilə əsasən imam inancını qəbul etməyi necə gözləyə bilərlər? Üstəlik əgər lütf, yəni insanların hidayəti üçün peyğəmbərlər, imamlar təyin etmək Allaha vacib olsaydı o zaman Allahın bu etdiyinə görə insanlara minnət qoyması doğru olmazdı. Halbuki Allah – cəllə cəlaluhu – buyurur: “Onlar islamı qəbul etdiklərinə görə sənə minnət qoyurlar. De: “Müsəlman olduğunuzla mənə minnət qoymayın! Xeyr, əgər (iman gətirdiyinizi) doğru deyirsinizsə, (bilin ki) sizi imana müvəffəq etməklə, əslində Allah sizin boynunuza minnət qoymuş olur!”[49:17] Əgər peyğəmbər, imam göndərmək Allaha vacib olsaydı İbrahim peyğəmbər bunu Allahdan istəməzdi, çünki vacib olan bir şeyi istəmək əbəs olardı. “Ey Rəbbimiz! Onların içərisindən özlərinə Sənin ayələrini oxuyan, onlara kitabı və hikməti öyrədən və onları (günahlardan) təmizləyən bir peyğəmbər göndər! Şübhəsiz ki, Sən qüdrətlisən, hikmət sahibisən.”[2:129]

## İmamların olması işə yarayıbmı?

Burada çox önəmli bir nöqtəyə toxunmağımız lazımdır. Şiə etiqadına görə imamların olması zəruridir və Allahın ümməti ixtilaflardan qoruması üçün imamları vəzifələndirməsi Allahın lütfünün gərəyidir. Murtəda əş-Şərif bu məsələni müzakirə edərkən ümumən insanların dini məsələlərdəki ixtilafını iki yerə ayırır. Birinci növ əqli məsələlərdir ki, bu məsələlərdə əqli dəlillərlə “hüccət tamamlanırsa və ona çıxış, şərtlərin hamısına sahib olan hər kəs üçün mümkündürsə o zaman bu məsələdə imama ehtiyac yoxdur.” Daha sonra dəlilləri nəqli olan məsələlərə toxunur və onu da iki yerə ayırır.

[1695] “əş-Şeyx Muhəmməd Rida əl-Muzaffər əl-Fəlyəsuf val-Mufəkkir əl-İraqi əl-Kəbir”, səh: 81-83; Kufa Academy, 2022

Mütəvatir əsaslar üzərində olan, üzrü aradan qaldıran və şəkkə yer buraxmayan qəbildən olan nəqli dəlilləri olan məsələlər ilə bu cür olmayan məsələləri ayırır. Bu ikinci hal haqqında yazır: "Haqqında xəbərlərin mütəvatir gəlmədiyi məsələlərdə imama ehtiyacın olması aşkardır, çünki əgər ixtilaf baş verərsə, onun sözündən və izahından başqasına sığınacaq yer yoxdursa, o zaman (imam) ixtilafı aradan qaldırmaq üçün hüccətdir." Bunun ardından əlavə edir: "Bizim "(imam) ixtilaflı məsələlərdə hüccətdir" sözümüzün mənası kitabın müəllifinin başa düşdüyü məna deyildir; yəni imamın mövcud olması ixtilafı tamamilə aradan qaldırmaq mənasında deyildir. Qəsd etdiyimiz budur ki, ixtilaf məqamında onun sözü sığınacağımız yer və hüccət olacaq və əgər imam olmazsa Allahın ixtilaf edənlər üzərində heç bir şeydə hüccəti olmaz. Üstəlik imamların mövcud olduğu halda dini məsələlərdə baş verən ixtilaf heç bir şəkildə onların mövcud olmadığı haldakı ixtilafla bir ola bilməz, beləki onların mövcud olmaqlarının bu ixtilafı aradan qaldırmaqda aşkar bir üstünlüyünün olması labüddür və bu, onu göstərir ki, onlar olduqda ixtilafın tamamı aradan qaxlmasa belə, ixtilaf (böyük bir ölçüdə) aradan qalxa bilər..."[1696] Burada əsas müzakirə nöqtəsinə keçmədən əvvəl iki yerə aydınlıq gətirməyə ehtiyac vardır. Birinci yer budur ki, "kitabın müəllifi" sözü ilə Murtəda əş-Şərifin qəsd etdiyi şəxs məşhur mötəzili alimi əl-Qadi Abdulcabbar əl-Həmədani'dir, çünki şiə alimi "əş-Şafi" adlı kitabını ona cavab olaraq yazıb. İkincisi isə "hüccət" arqumentinin özü ilə bağlıdır. İmam olmadan Allahın qulları üzərində hüccətinin tamamlanmadığını iddia etmək Qurana müxalifdir və Quranı yalanlamış olur. Allah – təalə - buyurur: "Müjdə verən və xəbərdar edən (peyğəmbərlər göndərdik ki,) peyğəmbərlərdən sonra insanların Allaha qarşı bir bəhanəsi qalmasın. Allah qüdrətlidir, hikmət sahibidir." [4:165] Bu ayədə aşkar sözlərlə ifadə edilir ki, peyğəmbərlərdən sonra insanların üzərində Allahın hüccəti tamamlanır. Bunu da bəyan etdikdən sonra əsas mətləbə keçməyin vaxtı gəlir. Beləki sözlərini oxuduğumuz şiə alimi açıq şəkildə bildirir ki, imamların mövcud olması müsəlmanların arasındakı ixtilafı ciddi şəkildə azaldır, tam aradan qaldırmasa da o ixtilafın zərərli hissəsini, fəsada səbəb olan miqdarını yox edir. Həqiqətən də belədirmi? Əgər bu doğrudursa biz bunun nəticəsini on iki imamı qəbul etmiş şiə tayfasında görməliyik, onların arasındakı ixtilaf sünnət əhlinə nisbətdə xeyli az olmalıdır. Lakin yaxından nəzər yetirdiyimizdə vəziyyətin heç də belə olmadığı anlaşılır.

[1696] əl-Murtəda, "əş-Şafi fil-İmamə", 1/102;

Reallıq budur ki, "cəfəri" adlandırdıqları məzhəbin içində də ixtilaf kifayət qədər çoxdur. Özlərini cəfəri hesab edən şiə mərciləri, yəni "müctəhidləri" xeyli fiqhi məsələdə öz aralarında ciddi ixtilaflar ediblər. İmami şiələrində fiqhi məsələlərdəki ixtilaf qədimdən bəri mövcud olub, hətta demək olar ki, ilk əsrlərdə bu ixtilaf daha şiddətli olub. Şeyxut-Taifə adlandırdıqları Əbu Cəfər ət-Tusi "əl-Uddə fi Usulil-Fiqh" adlı kitabında (1/136-138) deyir: "Bizim işarə etdiyimiz bu xəbərlər ilə əməl etməyin icazəli olmasına dələlət edən tərəflərdən biri də haqq firqənin öz aralarında bu xəbərlər ilə əməl etməkləri səbəbi ilə ortaya çıxmış ixtilafdır, belə ki, mən bu haqq firqəni əhkam mövzusunda məzhəbləri müxtəlif olaraq gördüm; təharətdən başlayaraq diyət bablarına qədər fiqhin bütün bablarında ibadətlərdə, hökmlərdə, müamələlərdə, mirasda və başqa məsələlərdə birinin fətva verdiyi ilə digəri fətva verməmişdir. Orucda (günlərin) sayı və (hilalı) görmək məsələsi, üç dəfə "boşama" sözünü tələffüz etməyin bir boşama sayılıb sayılmaması məsələsi buna misaldır. Həmçinin təharət babındakı ixtilafları da buna misaldır; misal üçün heç bir şeyin nəcis etmədiyi su miqdarı məsələsindəki ixtilafları və kurrun miqdarındakı ixtilafları, başı və ayaqları məsh etmək üçün yeni su götürməkdə ixtilafları, nifasın ən uzun müddəti haqqındakı ixtilafları (bu babdan verə biləcəyimiz bəzi) misallardır. Eləcə də azan və iqamə ilə bağlı bir çox fəsllərdə ixtilafları və bundan başqa digər fiqhi bablardakı ixtilafları misal ola bilər. Hətta tayfanın alimlərinin fərqli fətvalar ilə bir neçə və ya bir məsələdə ixtilaf etmədikləri heç bir salamat bab tapa bilmədim. "əl-İstibsar" kimi tanınmış kitabımda və "Təhzibul-Əhkəm" kitabında onlardan – aleyhimussələm – varid olmuş fiqhə xas olan beş mindən çox müxtəlif hədis zikr etmişəm və onların əksəriyyətində tayfanın o xəbərlərlə əməl etmək barəsindəki ixtilafını da zikr etmişəm. Bu, heç kəsdən gizli qalmayacaq qədər məşhurdur. Hətta sən onların bu hökmlərdəki ixtilafları üzərində düşünsən onların Əbu Hənifə'nin, əş-Şafi'nin və Malik'in ixtilaflarından daha çox olduğunu görəcəksən..."[1697] Beləliklə də Əbu Cəfər ət-Tusi bu sözləri ilə təsdiq edir ki, özündən öncəki şiə alimləri gəlmiş xəbərlərdəki ziddiyyətlər səbəbi ilə çoxca ixtilaf ediblər, hətta bu ixtilaflarının müqayisədə sünni məzhəblərinin öz aralarındakı ixtilaflarından daha çox olduğunu deyir. Bu ixtilaflar hətta o dərəcəyə çatmışdı ki, bəzi şiə alimləri bu səbəblə şiəliyi tərk etməyin doğru qərar olacağına qane olmuşdular. Dövrün sünnət əhli alimləri bu ixtilafları göstərərək şiələrin etiqadının tutarsız olduğunu bildirirdilər. Belə bir

---

[1697] ət-Tusi, "əl-Uddətu fi Usulil-Fiqh", 1/136-138; Muhəmməd Rida əl-Ənsari təhqiqi

mənzərə qarşısında bu ixtilafları həll etmək layihəsini başladan ilk şiə alimlərindən biri Əbu Cəfər ət-Tusi olub. Şeyxlərindən biri olan əl-Mufid'dən aldığı məlumat əsasında bəzi şiə alimlərinin şiəliyi tərk etdiyini bildikdən sonra şeyxinin "əl-Muqnia" kitabına şərh yazmaq qərarına gəlir. "Təhzibul-Əhkam" adı ilə tanınan bu şərhinin müqəddiməsində etiraf edərək deyir: "Üzərimizdə vacib haqqı olan dostlarımızdan biri – *Allah ona dəstək olsun!* - əshabımızın – *Allah onlara dəstək olsun və onlardan ölüb keçmişlərinə rəhm etsin!* - hədisləri, onların arasındakı ixtilaf, fərqlilik, ziddiyyət və təzadlar – *hətta az qala elə bir xəbər yoxdur ki, qarşısında ona zidd bir başqa xəbər olmasın, elə bir salamat hədis yoxdur ki, onun müqabilində ona qarşı gələn başqası olmasın* – barəsində müzakirə açdı. Hətta müxaliflərimiz bunu bizim məzhəbimizə qarşı ən böyük tənələrdən hesab ediblər və bununla bizim etiqadımızı batil çıxarmağa yol tapıblar. Zikr ediblər ki, sizin keçmişdə və indiki şeyxləriniz daima öz müxaliflərinə tənə ediblər ki, Allaha itaət üçün seçdiyiniz dininizdə ixtilaf edirsiz və furu məsələlərində rəylərinin fərqlənməsini onlara qarşı eyib göstərirlər və deyirlər ki, bu cür din hikmətli birinin etiqad edəcəyi və elmli birinin əməl etməsinə imkan verəcək din ola bilməz, halbuki biz sizin öz müxaliflərinizdən daha şiddətli ixtilafda olduğunuzu, sizdən ayrı olanlardan daha çox ayrılığa düşdüyünüzü görürük. Bu cür ixtilafın batil olduğuna etiqad etdiyiniz halda belə bir ixtilafın sizin özünüzdə olması əslinizin fasid olmasının ən böyük dəlilidir. Hətta elmdə güclü olmayan, nəzəri düşüncənin fərqli yolları və ləfzlərin fərqli mənaları haqqında bəsirəti olmayan bir qrupa bu səbəblə şübhə daxil oldu və onlardan bir çoxu bu məsələnin izahı onlara qarışıq gəldiyi üçün və buradakı şübhəni həll etməkdən aciz olduqları üçün haqq etiqadından döndülər. Şeyximiz Əbu Abdilləh'dən – Allah ona dəstək olsun! – eşitdim ki, Əbul-Həsən əl-Həruni əl-Ələvi əvvəl haqq etiqadında idi və imamətə inanırdı və sonra hədislərdəki ixtilaf ona qarışıq gəldiyi üçün bu etiqadından döndü, məzhəbi tərk etdi və başqa məzhəbə tabe oldu, çünki onlardakı mənaların izahı ona aydın olmadı. Bu ona dəlalət edir ki, o, haqq məzhəbə bəsirət ilə daxil olmamışdı və məzhəbə təqlid yönündən etiqad etmişdi. Çünki furu məsələlərindəki ixtilaf dəlillərlə sabit olmuş üsulu tərk etməyi vacib etmir..."[1698] Burada şeyxi Əbu Abdilləh deyərək yad etdiyi kəs əl-Mufid'in özüdür. ət-Tusi'nin axırda cavab qismində həmin sözlərini bir daha xatırladıram: "Çünki furu məsələlərindəki ixtilaf dəlillərlə sabit olmuş üsulu tərk etməyi vacib etmir." Yəni ət-Tusi

[1698] ət-Tusi, "Təhzibul-Əhkəm", 1/1-2;

deyir ki, furu məsələlərində, yəni əməl ilə, əhkam ilə bağlı olan fiqhi məsələlərdə ixtilafın çoxluğu heç də məzhəbin etiqadı əsasının xətalı olduğuna dəlil deyildir, çünki etiqadi əsasın dəlilləri fiqhi mövzuların dəlillərindən fərqlənir. ət-Tusi'nin verdiyi cavab əslində ümumi olaraq doğrudur, amma bu cavab şiələrin etiqadı ilə uyğun gəlmir. Belə bir cavab sünnət əhlinin məzhəbləri arasındakı ixtilaf üçün keçərlidir, çünki sünnət əhlindəki fiqhi ixtilafın etiqad əsaslarına heç bir zərəri yoxdur. Şiələrdə isə məsələ bu cür deyildir, beləki şiələr, inandıqları imamların mövcud olmasının zərurətini isbat etməyə çalışarkən onları bu cür ixtilafları aradan qaldırmaq üçün mövcud olduqlarını deyirlər. Bununla bağlı Murtəda əş-Şərifin sözləri ilə tanış olduq.

Belə bir ixtilafın şiələr arasındakı mövcudiyyəti digər şiə alimlərinin sözlərində də öz təsdiqini tapır. Hətta şiələrin bir başqa məşhur alimi Radiyyuddin İbn Tavus fiqhdə tək bir kitabdan başqa heç bir kitab yazmamağını da rəvayətlər və fətvalar arasındakı ixtilafların çoxluğu ilə əlaqələndirir. O deyir: "Bil ki, fiqhdə ölülərin adından namazları qəza etmək mövzusunda yazdığım "Ğiyəsu Sultan əl-Vara li Sukkənis-Səra" adlı kitab ilə kifayətlənməyim, fiqhdə, sualların təqriri və cavablarında bundan başqa kitab yazmamağımın səbəbi budur ki, bu dünyada və axirətdə məsləhətimin və qurtuluşumun şəriət hökmlərində fətva verməkdən uzaq durmaq olması qənaətində olmağımdır, çünki alimlərimizdən fəqih olanların arasında rəvayətdəki ixtilafların olduğunu gördüm..."[1699] Həmçinin əl-Feyd əl-Kəşşəni "əl-Vafi" adlı əsərinin müqəddiməsində şiə fəqihlərinin tarixin gedişi ilə çoxlu ixtilaflara düşdüklərini bu cür zikr edir: "Bunların hamısı məsələlərdə öz aralarında çoxca ixtilaf etməklərinə, gecə-gündüz ixtilafın artmasına və əhatə dairəsinin genişlənməsinə səbəb oldu. Hətta vəziyyət o həddə çatdı ki, onları bir məsələdə iyirmi və ya otuz və ya daha çox rəy üzərində ixtilaf edərkən görürsən. Hətta istəsən deyə bilərəm ki, elə fəri bir məsələ qalmayıb ki, onun özündə və ya onunla bağlı bəzi hissələrində ixtilaf etməsinlər."[1700] Onu da qeyd edək ki, bu məsələlər təkcə furu məsələləri ilə məhdud olmayıb, üsul və əqidə məsələlərində belə ixtilaf ediblər. İbn Tavus yazır: "Elmin çox dallarında alim olan Şeyx Qutbuddin ər-Ravəndi'nin - və adı Said bin Hibətullah'dır - əş-Şeyx Mufid və əl-Murtəda arasındakı ixtilaf haqqında bir dəftər - *halhazırdaməndədir* - yazdığını gördüm. Bu ikisi - *xüsusilə də şeyximiz*

[1699] əl-Məclisi, "Bihərul-Ənvar", 104/42;

[1700] əl-Kəşşəni "Təfsir əl-Vafi", 1/16;

*əl-Mufid* - öz zamanlarında ən əzəmətli şəxslərindən olublar. Beləliklə də o dəftərdə üsul elmində bu ikisi arasında ixtilafın düşdüyü doxsan beş məsələni zikr edir və dəftərin axırında deyir: “Əgər onların ixtilaf etdikləri bütün məsələləri yazmalı olsaydım kitab uzanardı.”[1701] Nuruddin əl-Musəvi əl-Amili (vəfatı h. 1062) bu ixtilafı izah edərkən yazır: “Məlumdur ki, bu ixtilafın səbəbi yalnız və yalnız hədislərdəki ixtilaf ola bilər, əgər hədislərin hamısı səhih olsaydı, üsul və furudakı bütün hökmlər üçün hədislərdə dəlil olsaydı, onların bu cür ixtilaf etməkləri icazəli olmazdı. Əksər hallarda bu ixtilaf, əl-Murtəda əş-Şərifin əhəd xəbərləri rədd etməsindən, əl-Mufid’in isə onlarla əməl etməsindən qaynaqlanır.”[1702]

Hətta müasirlərindən bir çoxu müasir “müctəhidlərinin” ictihadlarında keçmiş şiə alimlərin təqrirlərinə müxalif olduğunu etiraf edirlər. Cəfər əş-Şəxuri əl-Bəhrani müasirlərdən Seyyid əl-Xoyi’nin keçmişdəki əs-Saduq və əl-Mufid kimi şiə alimlərinə müxalif olduğunu zikr edir və keçmişdə şiə alimləri arasında məşhur hesab edilən rəylərə müxalif rəylərinin 10-larla olduğunu deyir. Özü daha sonra bunlardan 30-unu qısa şəkildə zikr edir və sonra deyir: “Əgər Seyyid Xoyi’nin məşhur və ya icmaya müxalif olduğu yerlərin hamısını zikr etmək istəsəydik sayı iki yüz və ya üç yüz fətvaya çatardı. İmam Xomeyni, Hakim və başqalarının da halı belədir.”[1703] Beləliklə də şiə tayfasının fiqhi məsələlərdə öz aralarında ixtilaf etdiyi məşhurdur, sabitdir. Hətta öz alimləri bu ixtilaflar haqqında kitablar yazıblar. Misal üçün İbnul-Mutahhər əl-Hilli (h. 648-726) bu mövzuda “Muxtələf əş-Şiə” adlı kitabını qələmə alıb. Kitaba giriş verərkən deyir: “Fiqh elmində mütəqaddim əshabımızın… kitabları və keçmiş alimlərimizin məqalələri ilə tanış olduğumda çox saylı fərqli məsələlərdə, ayrı-ayrı böyük mövzularda ixtilaf etdiklərini gördüm. Ona görə də ittifaq etdiklərini yox, məhz şəriət hökmlərində və fiqh məsələlərində ixtilaf etdiklərindən bizə çatanları ehtiva edən bir düsturda o məsələləri qeyd etmək istədim…”[1704] On il ərzində yazılmış bu kitab hicri 1433-cü ildə Qum şəhərində doqquz cild olaraq çap olunub və gördüyümüz kimi əl-Hilli kitabında yalnız ixtilaf etdikləri mövzuları qeyd etdiyini söyləyir. Bu

---

[1701] İbn Tavus, “Kəşful-Məhəccə li Səməratil-Muhcə”, səh: 64; Mussəsətu Bustan Kitab, Qum, 1430

[1702] “əl-Fəvaid əl-Mədəniyyə va bi Zeylihi əş-Şəvahid əl-Məkkiyyə”, səh: 35; Muəssəsətu ən-Nəşr əl-İsləmi, Qum, 1426

[1703] əl-Bəhrani, “Mərci’iyyətul-Mərhələ va Ğubərut-Təğyir”, səh: 138;

[1704] əl-Hilli, “Muxtələf əş-Şiə”, 1/173;

kitabın ikinci cildi başdan ayağa namaz haqqındakı ixtilafları zikr edir. Bu məsələlərdən bəziləri bunlardır: müxtəlif yerlərdə namaz qılmağın icazəli olub olmaması, qılındığı təqdirdə fasid olub olmaması, azan və iqamənin camaat və tək namazlarda vacibliyi, azanın minarədən başqa yerdə verilməsi, qadının kişilər üçün azan verməsi, dəstəmazsız və ya qibləyə dönmədən iqamə vermək, iqamədə danışmağın hökmü, ayaq üstə durmadan iqamə vermək, azanda "əs-salətu xayrun minən-nəum" deməyin məkruh yoxsa haram olması, azana görə ücrət almağın hökmü, azanda və iqamədə sözlərin sayları, fasiqin azanının hökmü, namaz əsnasında niyyəti dəyişmək namaza təsiri, qiraətin namazda rükun olub olmaması, fatihədən sonra əlavə surə oxumağın vacibliyindəki ixtilaf, camaat namazına qoşulduqda həm istiftah, həm də rüku niyyəti ilə bir təkbir verməyin hökmü, qiraətin yerinə deyilən təsbihin miqdarı, bir rükətdə iki surət oxumaq, sübh və məğribdə səslə oxumağın hökmü, oxunmadığı təqdirdə namazın hökmü, surələrin əvvəlində "bismilləhir-rahmənir-rahim" sözlərini səslə oxumağın hökmü, cümə günü zöhr namazı qılana "cümə" və "munafiqun" surələrini oxumağın vacibliyi, rüku və səcdələrdə təsbihdən başqa zikr deməyin hökmü, təsbihdə vacib olan say, eşidənə tilavət səcdəsinin vacib olub olmaması, istiftəh təkbirindən başqa təkbirlərin hökmü, namazın təkbirlərində əlləri qaldırmağın hökmü, istirahət oturuşunun hökmü, namazda qunut tutmağın vacib olub olmaması, namazda salamların vacib yoxsa müstəhəb olması, beş namazdakı təkbirlərin sayı, qunutda farsca dua oxumağın hökmü, bütün namazlarda qunutu səsli oxumağın hökmü və sair. Bu məsələlərin sayını çoxaltmaq olar. Elə məsələlər var ki, o məsələlərdə sünnət əhlinin dörd məzhəbi ittifaq edib, lakin şiələr öz aralarında ixtilaf ediblər. Misal üçün yəhudi və xristian qadınla evlilik sünnət əhlinə görə səhihdir, şiələr isə ixtilaf ediblər. Şiə alimi Muhəmməd Cavad Məğniyyə yazır: "Sünnilərin dörd məktəbi də kitab əhlindən qadınla evliliyin səhih olmasında ittifaq edib. Şiələrin fəqihləri isə öz aralarında ixtilaf ediblər..."[1705] Həmçinin cümə namazı sünnət əhlinə görə vacibdir, şiələr isə haram olması ilə vacib olması rəyləri arasında ixtilaf ediblər. Hətta sünnət əhlinin özünün təmiz yoxsa nəcis olmasında belə ixtilaf ediblər. Burada diqqət edilməsi önəmli olan nöqtə budur ki, şiələrdə mövcud olmuş alimlərin, müctəhidlərin sayı sünnət əhlindəki alimlərin və müctəhidlərin sayından dəfələrlə azdır, hətta hənəfi məzhəbindəki alimlərin sayı şiələrdəki alimlərdən çoxdur. Bununla belə ixtilaf baxımından əgər

---

[1705] Məğniyyə, "ət-Təfsir əl-Kəşif", 1/334; Darul-Ənvar, Beyrut

şiələr - öz alimlərinin etiraflarına əsasən - daha çox ixtilaf ediblərsə bunun yalnız tək bir səbəbi vardır; onlara doğru dini çatdıracaq imamları olmayıb və iddia etdikləri imamlar əslində onlara təqiyyə edib, doğru olmayan fətvalar veriblər, şiələri heyrətə salıblar.

Bu gün şiələr arasında qəbul edilmiş etiqadlardan biri də ölülərin nə zamansa dünyaya qayıdacaqları inancıdır. əl-Mufid yazır ki, "ölülərin xeyli bir hissəsinin dünyaya qayıtmasının vacibliyində imami şiələr ittifaq ediblər..."[1706] Bu qayıtma inancı şiələrdə "rac'ə" olaraq tanınır. əl-Hurr əl-Amili bu məsələdə şiələrin icma etdiklərini iddia edir və bu icmaya dəlalət edən dəlillərdən biri olaraq onların "racə haqqındakı xəbərləri rəvayət etməkdəki ittifaqlarını" göstərir.[1707] Ona görə də bir çox şiə alimi bu etiqadı məzhəbin zərurətlərindən hesab ediblər. Eyni zamanda bəzi şiə alimləri təsdiq edirlər ki, bu etiqad məzhəbin üslundan deyildir, buna etiqad etmək vacib deyildir.[1708] əş-Şərif əl-Murtəda bununla bağlı yazır ki, "məzhəbin zəruriyyətlərindən deyildir" və şiələrə görə buna etiqad etmək vacib deyildir, tarixi bir xəbər misalındadır, kimin nəzərində bu tarixi xəbər sabit deyilsə onu inkar etməyə görə günah yazılmır.[1709] Şeyx Kəşif əl-Ğita isə "Əsluş-Şiə va Usuluhə" kitabında yazır ki, "racə etiqadına inanmaq şiə məzhəbinə görə vacib deyildir, onu inkar etmək zərər verməz. Üstəlik yazır ki, bu etiqadın onun nəzərində "bir dırnaq qopuğu qədər əhəmiyyəti yoxdur."[1710] Maraqlıdır ki, etiqadi məsələlərdə belə şiə alimləri öz aralarında bu qədər aşırı dərəcədə ixtilaf edə biliblər.

Bəli! Şiə tayfasındakı belə şiddətli ixtilaf imamət inancı ilə uyğun gəlmir. Çünki imamət üçün gətirdikləri ən əsas əqli dəlilləri budur ki, imamlar peyğəmbərin varisi olaraq ümmətə dini və dünyəvi işlərində doğru yolu göstərən hidayət rəhbərləri olmalıdırlar və insanlara dini və dünyəvi məsələlərdə doğru olanı bildirmələri üçün xətadan qorunulmuş məsumlar olmaqları lazımdır. O zaman burada soruşmaq lazımdır ki, əgər "məsum" imamların aranızda mövcud olmasına baxmayaraq bu qədər ixtilaf etmisizsə o zaman onların mövcud olması ilə olmamaqları arasındakı fərq nə oldu?!

---

[1706] əl-Mufid, "Əvail əl-Məqalət", səh: 46;

[1707] əl-Amili, "əl-İyqaz min əl-Həcə bil-Burhan alə ər-Racə", 1/46;

[1708] Bax: əl-Muzaffər, "Aqaid əl-İməmiyyə", səh: 74-75; Muhsin əl-Əmin, "Nəqdul-Vaşiə", səh: 376;

[1709] əl-Əmin, "Ayən əş-Şiə", səh: 174;

[1710] Kəşif əl-Ğita, "Əsluş-Şiə va Usuluhə", səh: 167-168;

## Cəfəri məzhəbi

Reallıq budur ki, sünnət əhlinin müctəhidləri peyğəmbərin hədislərini anlamaqda, onları tətbiq etməkdə ixtilaf etdikləri kimi şiələrin alimləri də öz imamlarına nisbət etdikləri xəbərləri anlamaqda ixtilaf ediblər, hətta bu ixtilafları daha dərin və daha çoxdur. Yəni imamların olması ixtilafı aradan qaldırmayıb, ona görə də onların məsumluğu heç bir şeyi dəyişdirməmişdir. Son etapda formalaşan rəylər "müctəhid" adlanan bəşər övladlarının nəzərinin məhsuludur. Bunun səbəbini isə başa düşmək heç kimə çətin gəlməməlidir. Çünki Cəfər əs-Sadiq – radiyallahu anhu – özündən sonra fiqhi bir kitab tərk etməyib, ümumiyyətlə heç rəvayət kitabı da tərk etməyib. Fiqhdə, hədisdə öz əli ilə kitab yazmadığı kimi onun ən yaxın tələbələri də onun fiqhini, hədislərini bir araya toplayıb kitab halına gətirməyiblər. Bu faktı dörd məzhəb imamı ilə müqayisə etsək nə görəcəyik? İmam Əbu Hənifə'nin fiqhini, eləcə də tələbəsi Əbu Yusuf'un fiqhini onun ən məşhur tələbəsi Muhəmməd bin əl-Həsən əş-Şeybəni yazıb. İmam Malik özü "əl-Muvatta" kitabını qələmə alıb ki, bu kitab həm hədis, həm də fiqh kitabı sayılır. Tələbəsi İbnul-Qasim isə öz tələbəsinin ona şeyxi Malikin verdiyi cavablarla "əl-Mudəvvanə" kitabının hasil olmasına səbəb olub. İmam əş-Şafi'yə gəldikdə isə özündən sonra fiqh, üsulul-fiqh və hədis üzrə kitablar tərk edib. Bu gün "əl-Umm" kitabı olaraq çap olunan kitabın içərisində İmam əş-Şafi'nin "ər-Risələ" adlı üsulul-fiqh kitabı, Mədinə və Kufə əhlinə cavab olaraq yazdığı fiqhi risalələr yer alır. Həmçinin tələbələri əl-Buveyti və əl-Muzəni əş-Şafinin fiqhini müxtəsərlərdə qələmə alıblar və bu gün biz əl-Muzəni'nin və əl-Buveyti'nin müxtəsərlərini əlimizə götürüb oxuya bilirik. İmam Əhmədə gəldikdə isə "əl-Musnəd" kitabının müəllifidir. Fiqhdə özü kitab yazmasa da tələbələri ona verdikləri suallara aldıqları cavabları yazıblar və bu kitablar bu gün "əs-Suələt" adı ilə çap olunub. Bəs Cəfər əs-Sadiq necə? Onun məzhəbini biz bu gün hansı kitablardan oxuyub öyrənə bilirik? Çox təəssüf ki, belə bir kitab yoxdur. Şiələrin hədis qaynaqları olaraq ən etibarlı kitabları içində ən qədim məsdər əl-Kuleyni'nin "əl-Kəfi" kitabıdır. Cəfər əs-Sadiq hicri 80-ci ildə doğulub və 148-ci ildə vəfat edib. əl-Kuleyni isə üçüncü əsrin ikinci yarısında

doğulub və hicri 329-cu ildə vəfat edib, yəni Cəfər əs-Sadiq'dən təxminən iki əsr sonra vəfat edib. Bu kitabdan sonra ikinci yerdə İbn Bəbəveyh əl-Qumi'nin (vəfatı hicri 381) "Mən lə Yəhduruhu əl-Fəqih" kitabı gəlir. Sonra isə Şeyxut-Taifə adlandırdıqları ət-Tusi'nin kitabları yer alır. Ola bilsin ki, bu yerdə desinlər ki, bu kitablardan da öncə "əl-usul" adlanan kitablar olub və onlarda imamlardan rəvayətlər olub. Lakin o kitablar hardadır? O kitablardan əsər-əlamət yoxdur, biz o kitabların necə olduğunu, içindəki rəvayətlərin nə qədər etibarlı olduğunu araşdırmaq imkanından məhrumuq. Bu gün özünü "cəfəri məzhəbinin" mərciləri adlandıranlar həmin bu rəvayət kitablarına, əs-Saduq, ət-Tusi kimi alimlərinin topladıqlarına qayıtmaqdan artıq bir şey edə bilmirlər. Sizcə vəziyyət belə olduğu halda iddia etmək olarmı ki, imami şiələri fiqhi məsələlərini bir başa imamın özündən öyrənirlər? Bu sualın cavabı asandır. Xeyr! Belə bir şey əsla səhih ola bilməz. Əslində imami şiələrinin fiqhi, öz aralarında ixtilaf edən alimlərinə qayıdır. Lənkərani, Sistani, Xoyi, Xamənəyi və adlarını eşitmədiyimiz bir çox mərcilərinin fətvalarına təqlid edirlər və adını "cəfəri məzhəbi" qoyurlar.[1711] Məzhəbin özünü Cəfərin məzhəbi adlandırmaqları da qəribədir, çünki Cəfər əs-Sadiq'in ictihadlarına tabe deyillər. Sünnət əhli Əbu Hənifə, Malik kimi imamların ictihadlarına təqlid etdikləri üçün özlərini onların məzhəblərinə nisbət edirlər, amma özlərini "cəfəri" adlandıranlar Cəfər əs-Sadiq'in ictihadlarına təqlid etmirlər, əksinə imamlara nisbət edilən və səhihliyi, zəifliyi üzərində ixtilaf edilən rəvayətlər üzərindən, keçmiş alimlərindən gəlmiş nəqllər üzərindən ictihad etmiş "ayətullahlara" təqlid edirlər. Muhəmməd Hüseyn Fəzlullah bu həqiqəti belə etiraf edir: "Mərcilərin çoxluğu ilə bağlı üzləşdiyimiz problem elə fiqhi məzhəblərin çoxluğu ilə üzləşdiyimiz problemlə eynidir, çünki mərcilər elə fiqhi məzhəblərdir..."[1712] Ona görə də bəzi şiələrin özlərini "cəfəri" adlandırmaqları nə əqlən, nə də nəqlən doğru ola bilməz. Dediklərimizin doğruluğunu təsdiqləyən tərəf

---

[1711] Cəfəri məzhəbi bir ad olaraq ümumiyyətlə əvvəllər mövcud deyildi. Sünnət əhlinin məzhəbləri tarixində erkən bir zamandan hənəfi, maliki, şafii, hənbəli, cəriri, səvri, leysi məzhəbləri mövcud olub və onlardan yalnız bizim zamanımıza qədər dördü qorunub qalıb. Cəfəri məzhəbi isə bir məzhəb olaraq heç zaman mövcud olmayıb. İlk dəfə tarixdə cəfəri məzhəbi bir ad olaraq Nadir şahın zamanında ortaya çıxıb. Nadir şah İranın və İraqın sünni və şiə alimlərini bir araya toplayaraq onlar arasında bir uzlaşma, dialoq qurmaq istəmişdi. Bu görüş hicri 1156-cı ilin ramazan ayında Nəcəf şəhərində baş tutdu və ortaya "Nəcəf Vəsiqəsi" deyə bir sənəd çıxarıldı və bu sənədin ilk maddəsində "cəfəri məzhəbi" beşinci məzhəb olaraq irəli sürülürdü. Bu tarixdən əvvəl şiələrdə sadəcə olaraq "imami fiqhi" və ya "imami məzhəbi" bir termin olaraq istifadə olunurdu və bu məzhəb İmam Cəfərə nisbət olunmurdu.

[1712] "əl-Məalim əl-Cədidə lil-Mərcəiyyə əş-Şiiyyə", səh: 117;

budur ki, imami şiələrindəki məşhur olan rəyə görə bir müctəhid öldükdən sonra onu təqlid etmək olmaz, onlara görə yalnız diri müctəhidi təqlid etmək olar. O zaman özünüzə sual verin ki, əgər təqlid etdikləri məzhəb Cəfər əs-Sadiq'in məzhəbi olsaydı və məsələlərdə məzhəbin içində ixtilaf olmasaydı o zaman bu şərtlər nəyə lazımdır ki?! Üstəlik özünü Cəfər əs-Sadiq'ə nisbət edən bu müctəhidlər öz aralarında hətta dəlilləndirmə metodunda da ixtilaf edirlər; qiyasın batil olduğunu desələr də bir-birilərini qiyasa əsaslanmaqda ittiham edirlər. Misal üçün Əbul-Qasim əl-Xoyi naməhrəm qadının gözəlliklərini qəzəldə zikr etmək, yəni təşbib məsələsində Murtəda əl-Ənsari'ni tənqid edir və deyir ki, əl-Ənsari təşbibi haram sayarkən qiyasa əsaslanıb.[1713] Yusuf əl-Bəhrani hətta Şeyxut-Taifə ət-Tusi'ni "əl-Məbsut" kitabında bir çox hökmdə qiyasa əsaslanmaqda ittiham edir.[1714] Hüseyn əl-Kərki "Hidəyətul-Əbrar" kitabında şiələrin böyük alimlərini qiyasa əsaslandıqları üçün tənqid edir və kitablarından xeyli sayda misallar verir. Bunların başında Alləmə əl-Hilli və əş-Şəhid əs-Səni'nin adlarını çəkir və kitablarından nəqllər gətirir.[1715] Bu isə o deməkdir ki, günümüzdə özlərini "cəfəri" adlandıran şiə qardaşlarımız əslində İmam Cəfər əs-Sadiqə yox, ondan gəlmiş rəvayətlərin içindən ictihad edərək məzhəb qurmuş şiə müctəhidlərə tabedirlər. Bu məqam özlüyündə problem deyildir, problem olan burada "məsum imamın" varlığına dair gətirilən əqli dəlildir. Çünki nəticə etibarı ilə əhlüs-sünnət kimi alimlər təqlid olunacaqsa o zaman bu imamların, xüsusilə də qeybə çəkilmiş sonuncu imamın varlığının nə faydası vardır? Əgər imamların sözlərindən hansının təqiyyə ilə, hansının səmimi niyyət ilə deyildiyini müəyyən edən Şeyxut-Taifə ət-Tusi və onun yolu ilə getmiş şiə alimləridirsə, bu məsumların sözlərini nəql edənlərdən hansının etibarlı, hansının isə etibarsız olduğunu öyrədənlər ən-Nəcaşi və zamanımızda əl-Xoyi kimi alimlərdirsə "məsumluq" bunun harasında qalır?!

İmamət konseptinin şiələrin arasındakı ixtilafla və onun şiddəti ilə bağlı hansısa bir effektinin olmaması ilə bağlı yuxarıda yazdıqlarımız imamilərin üsuli adı ilə tanınan qoluna aiddir. Əxbarilər ilə üsulilər arasındakı münaqişə isə əslində çox şiddətlidir. Hətta 12-ci əsrin sonlarında üsulilərin lideri əl-Vahid əl-Bəhbəhəni əxbari alimlərindən

---

[1713] "Təliqa aləl-Məkəsib", 1/218; Təqrirat Bəhs əs-Seyyid əl-Xoyi, Muhəmməd Əli ət-Tövhidi

[1714] əl-Bəhrani, "Luluətul-Bəhreyn", səh: 297; əl-Xavansəri, "Ravdatul-Cinən", səh: 217;

[1715] əl-Kərki, "Hidəyətul-Əbrar ilə Tariq əl-Əimmətil-Əthar", səh: 308; birinci nəşr, h. 1396;

əl-Bəhrani'nin arxasında namazın səhih olmadığına fətva verirdi.[1716] Əxbarilər də öz növbəsində üsulilərə qarşı şiddətli idilər. Hətta onlardan bəziləri üsulilərin kitablarını əli ilə tutmazdı, paltarının ətəyi ilə toxunardı ki, nəcasətə bulaşmasın.[1717] Hicri on üçüncü əsrin ilk yarısında əxbarilərin lideri Mirzə Muhəmməd ən-Neyşəburi ilə üsulilərin böyüyü Cəfər Kəşif əl-Ğita ən-Nəcəfi arasında qızğın ədavət və müxalifət var idi. Tərəflər bir-birilərinə qarşı çox acı və təkfiredici sözlər işlədirdilər. Kəşif əl-Ğita'nın ən-Neyşəburiyə qarşı yazdığı təhrik edici kitabına ən-Neyşəburi "əs-Sayhətu bil-Haqq alə mən Əlhədə va Təzəndəqa" adlı bir kitab ilə cavab verir ki, adından da anlaşıldığı kimi qarşı tərəfi mülhid və zındıq olmaqda ittiham edir. Əgər hər iki tayfa eyni imamlara tabe olduqlarını deyirlərsə bir-birilərini təkfir və təfsiq edəcək şəkildə aralarında ədavət və ixtilafın olması heç bir şəkildə "imam" etiqadı ilə uyğun gəlmir. Məsumlardan qaldığı iddia olunan elmi miras bir fayda verməyibsə, bu imam vəzifəsinin zərurəti üçün gətirilən bütün "hikmət" və "məsləhət" ilə bağlı əqli dəlillər etibarsızlaşır.

---

[1716] Yusuf əl-Bəhrani, "əd-Durar ən-Nəcəfiyyə", 1/20; Məktəbətu Fəxravi, Bəhreyn, 1428;

[1717] ət-Taliqani, "əş-Şeyxiyyə", səh: 39; Dar Ələmira, Beyrut, 1428

**أشهد أن لا إله إلا الله وحده لا شريك له، وأشهد أن محمداً عبده ورسوله**

**.اللهم اجعلني من التوابين، واجعلني من المتطهرين**